# Kəşfül-Həqayiq

an-Nukətil-Ayati vəd-Dəqaiq

(Ayələrin Məna və İncəlikləriylə Həqiqətlərinin Açıqlanması)

Azərbaycan türkcəsində Qurani-Şərifin təfsiri

## III cild

**Müəllif və naşiri:**

Hacı Mirməhəmməd Kərim Mircəfər əl-Ələvi əl-Hüseyni əl-Musəvi
əl-Bakuvi

Bakı şəhərinin qazısı və quberniya məclisinin sədri

15 şaban 1322-ci il

7 yanvar 1904-cü ildə Tiflisdə senzura icazəsi ilə
"Kaspi" qəzetinin Buxariyyə mətbəəsində çap olunub.

## Bismillahir-Rəhmanir-Rəhim

# MÜQƏDDİMƏ

Hədsiz və bənzərsiz həmd və şükür varlığın yeganə Yaradıcısına layiqdir ki, varlıq içindən insan nəslini خَلَقَ الْإِنسَانَ عَلَّمَهُ الْبَيَانَ - "**İnsanı yaratdı, ona öz elmini öyrətdi"** (Rəhman, 55/3-4 ) seçib

عَلَّمَ بِالْقَلَمِ عَلَّمَ الْإِنسَانَ مَا لَمْ يَعْلَمْ - **Onu qələmlə öyrətdi və bilmədiklərini də"**(Ələq, 96/4-5) şərəfləndirdiyini və zinətləndirdiyini buyurubdur. Bütün varlığı bəşərin qüdrətinə tabe edib və hər bir xahiş və arzusunda özünə xidmət etməyə insanı müvəffəq edib sonsuz hikmətin insan vücudunda olmasına qərar verdi. Günəş və ay doğub batdıqca aləmin qüsurdan pak və müqəddəs tərbiyəçisi olan İlahi Zata sonsuz həmd və şükürlər olsun.

Haqq və hidayət yolunun müjdəçisi və hidayət verən, vəhşət və zəlillikdən qorxuducu olan yüksək məqam sahibi həzrət peyğəmbərlərin təmiz ruhlarına gecə və gündüz daim sonsuz dua və salam olsun. Xüsusən, insan nəslinin zirvəsi və hökmdarları olan uca peyğəmbərlərin və İslamın göz nuru, ilahiyyat alimlərinin istinadgahı, həniflik dininin qurucusu və İslam qanunlarının tənzimləyicisi, doğru yolun mürşidi, qayda-qanuna çatdıran, ilahi elmlərin müəllimi, qanunları möhkəmlədən, mədəniyyət və birlik binasını tərtib edən aləmlərin əfəndisinə (Hz. Məhəmmədə) də salam və dua olsun. Zəlalətin, cəhalətin, inadın kökünü qoparıb nəfs islahına, elmi təhsil edib onunla əməl etməyə yönəlt, onları cəhalət, günah və saxtakarlıqdan uzaqlaşdır.

Hər bir müsəlman kişi və qadına "Əqsayi-şərif"də (Qüds) olsa belə elm təhsil etməyi fərz buyuran İslam dininin və ümmətinin rəhbəri, kainatın fəxri olan peyğəmbərimizin (Məhəmməd İbn Abdullahın) ruhuna daim sonsuz dua və salam olub, heç bir

zaman kəsilməsin və yenə onun təmiz əhli-beyti və xeyirli səhabəsi rəhməti geniş olanın himayəsində olub ruhları şad olsun.

*Bu hilal dövründə gül, eyləmə qəm,*
*Bir neçə gün elə mən də gülmüşəm.*
*Bədr olan zamanda gözəl hilalın,*
*Nur saçacaq göyə sənin camalın.*
*Biliк кəsb etməкlə dünyanı qazan,*
*Əsmanı oxu кi, məna alasan.*

Qiymətli hikmət sahiblərindən və məşhur şairlərdən olub dünyada özünə gözəl ad qazanan (Şeyx Nizami Gəncəvi)nin dediyinə görə, gənclər 14 yaşına girib ilk yetkinlik yaşına çatan zamandan elm təhsilinə başlamağı təxirə salmaq caiz olmayıb hər şeydən əvvəl hikmət elmini öyrənmək vacib olub, elm təhsil etməyə ürəkdən səy və cəhd etmək lazımdır. Elm təhsili bəşəriyyətin ən birinci zəruri və vacib məsələsi sayılıb əqlən fərz hesab olunur. Elm təhsili etməyi 14 yaşından etibarən başlamağı şərt etməkdən məqsəd nəinki mərhum Şeyxin ondan əvvəl avaraçılıq və tənbəlliklə vaxt keçirməyi arzu etməsidir, necə ki bu şeirlərin əvvəlində yeddi yaşlı sevgili oğluna nəsihət edərək deyir:

*Yeddi yaşlı balam, gözümün nuru!*
*Dilimin əzbəri qəlbim süruru.*

Bəlkə 14 yaşında yetkin olan kimi zehin və fərasət inkişaf etməyə qadir olub, uca elmlərin təhsilinə başlayıb, o zamandan etibarən elm təhsilini təxirə salmanın caiz olmadığı mərhum Şeyxin arzu və məramıdır. Mərhum Şeyx əziz oğlunu elm təhsil etməyə kiçik yaşlardan həvəskar etməyi kainatın fəxri olan olan uca peyğəmbərimizin (*"Beşikdən qəbrə gedənə kimi elm təhsil edin"*) qiymətli kəlamından götürüb gözünün nuruna yuxarıdakı beytləri ilə elm öyrənməyi əmr edir. O beytlərin arxası belədir:

*Qaç o sözlərdən кi, mənasız, boşdur.*
*İlahi elmlər öyrənməк xoşdur.*
*Elə namuslu ol, desin hər görən:*
*"Ağıllı oğluna, Nizami, əhsən! "*

Əvvəldə göstərilən beytlərin mənası odur ki, əyləncə və oyunla vaxt keçirib eyş və işrətlə məşğul olmaqdan bir fayda meydana gəlməz. Hətta qiymətli vaxt puç olar. Biz də sizin kimi

nə qədər vaxt eyş-işrətlə məşğul olduq. Lakin yüz min dəfə heyif, o günlər cavanlıq həvəsi olub elm təhsili və fəzilət günləri boşa getdi. İndi siz cavanlığı qənimət bilib çirkin və batil sözləri və əməlləri tərk edib elm təhsil edin. Nəfsinizi kamilləşdirib o saf, xeyir əməllər ilə özünüzü bəzəyin və hər bir elm təhsil etməkdə məqsəd şəxsi mənfəət olmayıb din və millətə xidmət etmək gərək olsun, əziz vətən övladlarını cəhalət zülmətindən elm nuru tərəfinə yönəltmək əsl arzu olsun. Mərhum Şeyxin (İlahi elmlər öyrənməк xoşdur) misrasındakı arzu həmin mətləbdir.

Xüsusən, bizim bu bərəkətli son zamanlarda təhsil alıb müxtəlif elmlərdən agah olmaq zərurəti şübhəsiz ki, əvvəlcə İslam dininə aiddir. Elmin hər bir zamanda arzu edilən olmağı heç bir aqil şəxsə məxfi deyildir. Lakin bu zamanlarda biz İslam ümməti üçün daha vacib və əhəmiyyətli olmasında dəlil və sübuta ehtiyac yoxdur. Uca peyğəmbərimizin elm və mərifəti əmr etməyini biz İslam ümməti tərk edib cəhaləti özümüzə mütləq fərz saymışıq, guya, bizim əsl yaradışılımız cəhalət ilə yoğrulubdur. Cəhalət və zilləti iki əllə qucaqlayıb bağrımıza basmışıq. Digər millətlər uca peyğəmbərimizin hikmətamiz və şərəfli kəlmələrini və Qurani-Kərimin açıq-aydın ayələrini tam diqqətlə düşünüb, təfəkkür edib elm və hikmət barəsində var olan xəbərləri, ayələri oğurlayıb kitablar tərtib ediblər. Günəş kimi parlaq olan elmin şərqdən doğarkən qürub yeri olan qərbdən doğması kainatın fəxri olan Allah qulunun (Hz. Məhəmməd: *"Qiyamətin bir əlaməti günəşin qərbdən doğmasıdır"*) təsdiqi sayılır. Vaxt o vaxt və zaman o zamandır ki, bir an qəflətdə olmayıb millət rəisləri millətin övladlarını zəlil etməyib elm təhsilinə vadar etsinlər.

Mən həqirin Azərbaycan türkcəsində bu təfsiri yazmaqda məqsədi həmin türk dili ilə danışanların Qurani-Şərifdən ilahi ehkamı öz ana dilləri ilə dərk edib və elmin nə dərəcədə əhəmiyyətli olmağını Qurani-Şərifdən anlayıb, fəzilətindən agah olub elm təhsil etmələri arzu və muradımdır. Uca peyğəmbərimiz hədisi-şərifdə buyurduğuna görə, Allah-Təala açıq hikmət və qüdrəti ilə maddə və bitkilərdən başqa 3 sinif məxluq yaradıbdır. Birinci qismi ancaq xalis şəhvət olub yemək, içmək, yatmaqdan başqa, bir şey dərk etməyib və heç bir şeyə məsul olmayıb, ancaq insan nəslinə xidmət etməkdən ötrü yaradılıblar. Bu qisim heyvanlardır. İkinci qismi xalis əql olub nəfs şəhvətindən onlarda

bir əlamət görülməyib sırf elm nuru olub “mələklər və mücərrəd ruhlar” adı ilə adlanırlar. Üçüncü qismi insandır. İnsan bu iki qisim məxluqun arasında müştərək - yarısı mələk, yarısı heyvan olan bir məxluqdur. Mövlana Cəlaləddin Rumi bu məqama işarə edib deyir:

“İnsanın iç aləmi meşə kimidir. Bəzən şeytan olur, bəzən də mələk.”

Heyvanlıq (şəhvət və qəzəb) və mələklik (əql) cəhətinin hər ikisi insanda mövcuddur. Bəs əgər insan elm və maarif təhsil edib nəfsini kamilləşdirməklə mələklik sifətini qüvvətləndirib heyvanlıq yönünü zəlil və zəif edib bir zamana kimi həyatın davam və sabitliyinə səbəb olmaqdan başqa heç bir əlahiddə çirkin şeylərə meylli olmaya? Belə şəxs mələklər aləminə aid olub ona “mücərrəd ruh” demək layiqdir. Elm tələbəsi olanlara yer üzünün mələkləri demək bəhs olunan mətləbdən ibarətdir. Ya da ki, əgər insan elm və maarifdən tamamilə uzaq olub zülmət və cəhalət onun qəlbinin aynasını bulandırıb vəhşət və zillət dənizinə dalıb nicat ümidi ondan birdəfəlik gedə. Belə şəxsə əgər zahirdə insan deyilib, o, insan arasında yaşasa da, lakin həqiqətən insan aləmindən çıxıb birinci qisim heyvanata daxil olar. Bəlkə onda əmanət qoyulan şərəfli əqli zay etməklə Allah-Təala Qurani-Şərifdə xəbər verən kimi heyvanatdan əskik və aşağı olacaqdır. Necə ki, bu məqama Cəlaləddin Rumi işarə edib deyir:

İnsanın yarısı mələk, yarısı eşşəkdir. Eşşək olan yarısı tüfeyliliyə meyillidir. Digər yarısı isə ülvilik təmayüllüdür. Mübarizədə hansı qalib gələrsə o insan olar.

İnsan ana bətnindən dünya aləminə qədəm qoyarkən birinci heyvanlıq sifəti onda zühura gəlir: “Yemək, içmək sifəti, ondan sonra oyun, əyləncə, ondan sonra it kimi zərərli olar. Habelə yaşlanma yolunda irəlilədikcə əgər uşaqlıq halından boş qoyulub tərbiyə və təlimdən uzaq olsa, yaşlandıqca heyvanlıq sifətləri bir-bir meydana çıxar. Bir məqama çatar ki, daha o sifətləri ondan çıxartmaq mümkün olmayıb şeytanlıq, vəhşilik və cəhalətə qərq olar. Heyvanlıq sifəti ilə böyüməməkdən ötrü uca peyğəmbərimiz beşikdən başlayaraq elm təhsil etməyi ümmətinə vacib və lazım buyurubdur. Həm İslam ümmətinin ataları belə müqəddəs kəlamdan ibrət götürüb öz şəxsi övladlarını, ya da ki, onlara

tapşırılan övlad səviyyəsində olan müsəlman balaları, xüsusən, yetimləri və kasıb uşaqları bəlaya düçar etməyib onlardan ötrü məktəb və mədrəsələr açıb, elm təhsil etdirib, həm onları cəhalət və nadanlıq quyusundan çıxartsınlar, həm də dünya və axirət xeyir və mənfəətini qazansınlar.

Qurani-Şərifdə təkidlə tapşırılan yetim müsəlmanları zahirən çalışıb tələf olmaqdan qorumaq lazım isə də, lakin mənən çalışıb onun ruhunu xəbislik və zillətdən mühafizə etmək daha vacib və lazım deyilmi? Qurani-Şərifin hansı surəsinə və hansı ayəsinə baxılsa, özü bilavasitə elm olduğundan elm təhsil etməyə həvəsləndirib təşviq etdiyi açıq olaraq müşahidə olunar. Burasına diqqət edilməlidir ki, uca peyğəmbərimiz özü savadsız ikən Məkkədə əmiləri arasında peyğəmbərliklə vəzifələndirildi. Ərəb olub ərəb dilinə agah olmaqda o, Məkkə əhli olan Qüreyş tayfasına bərabər idi. Lakin peyğəmbərliyini isbat edib onlara qalib olmağı Qurani-Şərifin elmi səbəbinə olmadımı? Peyğəmbərliyi isbat üçün hər bir dəlil, sübut və möcüzə ondan istənən zamanda Allah-Təala Qurani-Şərifdə xəbər verən kimi: - **“O möcüzələrin heç biri məndən zühura gəlməz, bu Quran mənim möcüzəmdir, əgər siz də bacarırsanız, bir surə, bu Quranın ən kiçik surələrinin oxşarını gətirin”**, deyəndə onlar aciz qaldı və o da peyğəmbərliyini isbat etdi. Bu mətləb elmin hər bir şeydən uca olduğunu və hər bir şeyin elmin qüdrətinə tabe olduğunu isbat edir. Bəs peyğəmbərlərin rəhbəri olan uca peyğəmbərimizin peyğəmbərliyi elm ilə sabit olanda onun ümmətinin nə qədər elm təhsilində çalışmasının əhəmiyyətli və vacib olmağının heç bir dəlil və sübuta ehtiyacı yoxdur. Əvvəlcə bilir ki, bu məqamda bəzi zehinlərə xələl gəlib peyğəmbərliyin elm ilə sabit olmağında şübhə və şəkk ortaya qoysunlar. Lakin elmin dərəcələri vardır, ən uca mərtəbəsi Allah-Təala tərəfindən peyğəmbərlərə verilən elmdir.

Qurani-Şərif Allah-Təaladan uca peyğəmbərimizə göndərilib və o elm ona məxsus olub insan nəslindən bir nəfərin ona müqavimət göstərməyi mümkün olmadığına görə, ondan ötrü möcüzə olub onunla peyğəmbərliyi isbat edildi və əgər hər bir elm ilə peyğəmbərlik isbat edilsə, (və hər bir elm sahibi alimdir) qaydası ilə gərək, hər bir elmə agah olan şəxs peyğəmbər olsun. Bəlkə, uca peyğəmbərimizin peyğəmbərliyi bəhs olunan qayda

ilə ki, bir insan vasitəsi olmadan Allah-Təaladan ona elm gəlib və o elm ona məxsus olub ondan artıq heç kimin alim olmadığı sübut edilib, hidayət verən İslam dini yer kürəsinə yayıldı. Uca peyğəmbərimizin uca səhabəsinin bəzisinin digərlərinə olan üstünlüyü elm səbəbi ilə olmadımı və bu səbəbdən əmirəl-möminin Əli ibn Əbu Talibin digər səhabəyə olan üstünlüyü elm səbəbinə deyilmi? Hər bir şəxsin elmi artıq olsa, onun fəzilətinin də artıq olması şübhəsizdir. Əli (ə.s) buyurubdur: "Allahın peyğəmbəri mənə min qapı elmdən təlim etdi, hər qapıdan min qapı mənim üzümə açıldı, (yəni elmin kökünü mənim əlimə verdi, ondan ötrü elmlər məndən ötrü kəşf olundu)". II xəlifə Ömər ibn Xəttabın şura məclisində hər bir şəxs öz rəyini bəyan edəndən sonra Əli cənablarına "Sən danış, ey Əli," -xitabən deyib ondan rəy istəyirdi. Ömər ibn Xəttab Abdullah ibn Abbası daha çox istəyib uca səhabə ilə birlikdə onu öz məclisinə dəvət edərdi. Abdullah cavan olduğundan səhabədən bəzisi xəlifəni Abdullahı onlarla eyni saydığına görə qınadılar. Xəlifə Abdullahı bir neçə məqamda səhabələr ilə elmdə imtahan etdi və Abdullah onlara qalib gəldi. "Bu elm səbəbinə Abdullahı sizə üstün sayıram", – buyurdu, hamısı sakit oldular. İslam ümmətinin Qurani-Şərifin ehkamından və mətləblərindən ağah və xəbərdar olması ən birinci dini fərzdir.

İslam ümməti arasında məzhəb ixtilafı zühur edəndən bəri özlərini rəis və İslam dininin himayəçisi sayıb, əslində, İslam dininin yolunu kəsənlər öz mətləblərinə çatmaqdan ötrü: "Qurani-Şərifin mənasından sual etmək olmaz", ya da ki: "Quranın mənası Allah-Təala və peyğəmbərə məxsusdur" ya da ki: "Özləri imamlardan alıb bunlardan başqası alim ola bilməzlər" və ya: "Qurani-Şərifi özgə dillərə təfsir və tərcümə etmək olmaz"... belə mövhumat və mənasız sözlər ilə avam camaatı aldadıb İslam dininin əsası olan Qurani-Şərifin ehtiva etdiyi qanun və qaydalardan xalqı cahil və nadan saxlamağı üstün sayıblar. Şükür ki, bu dövr zamanların baharı olan elm dövrü olduğuna görə İslam ümmətinin demək olar ki, gözləri açılıb, hər bir elmə, xüsusən din elmi və Quran tərəfinə rəğbət onlarda fövqəladə hiss olunarkən ümidvar olmaq olar ki, bundan belə daha əvvəl bəhs olunan İslam düşmənlərinin mövhumatlarına qulaq verməyib İslam dininin açıq həqiqətini və Qurani-Şərifin uca məzmununu

dərk etməyə səy və cəhd etsinlər, bu səbəbdən İslam ümmətinin danışdığı və doğru qayda-qanuna sahib hər bir dildə Qurani-Şərifi təfsir etmək lazım və vacibdir. İslam ümməti ümumi olaraq Qurani-Şərifin uca məzmunundan agah olandan sonra eqoist, bəlkə, bütpərəst, İslam düşmənlərinin yaratdığı məzhəb ixtilafından agah olub müxtəlif məzhəb adlarını, xüsusən, iki əzəmətli qrup olan sünni-şiə adını məhv etməyə cəhd edib bir dinə tabe olub, bir İslamın adı ilə adlanmağa ittifaq edib İslamın müqəddəs adının altında cəm olmağı rica və ümid edirik.

əl-Fəcr surəsinin 17-ci ayəsinin təfsirində İslam dinindən ixtilafı yox etmək xüsusunda mən həqir təfsilat vermişəm. Belə ki, bu son xoşbəxt dövrlərdə müxtəlif adlarla məclislər təşkil olunub, hər biri bir adla adlanıb, İslam dini və ümməti xeyrinə fəaliyyət göstərirlər. Bunların hamısından vacib - "qal`ül-ixtilaf an dinil-islam" ("İslam dinindən ixtilafı yox etmək") adı ilə bir məclis qurub, İslam dinini yıxan ixtilafın nə olduğunu təhqiq edib, ixtilafa səbəb olan şeyləri yox edib bütün hamısı islamın şərəfli adının altına daxil olub İslam dininin inkişafı üçün səy və cəhd etsinlər. Bundan da gözəl və vacib iş varmı? Əgər adı keçən məclisdən ötrü qeyd etdiyim şərəfli ad bir qədər fərqli dil mənsubları üçün müşkül olsa da, lakin "qal`" ərəb dilində bir şeyi zorla, qüvvətlə bir möhkəm yerdən qoparıb çıxarmaq mənasında olduğuna görə, İslam dinindən ixtilafı yox etməyə bu adı münasib görüb qeyd etdim. Belə vaxtda qeyrətli və dindar şəxslər dəyişdirib başqa ad qoymaqda sərbəstdirlər. Belə bir zamanı dərk edən müsəlman qardaşlarımı təbrik edib səmimi qəlbdən dua edib sonsuz salam deyib mən həqirin təqsirini göstərmələrini rica edirəm. Bu günkü gündə İslam ümməti içində zühura gələn məzhəb ixtilafı Qurani-Şərifdən kənar düşüb Quran ehkamını tərk etməyə dəlil və sübut deyilmi? Quran bir kitabdır. Bir yolu və bir təriqəti əmr edir. Bu qədər müxtəlif təriqətlər haradan zühura gəldi?

İslam ümmətinə elm lazımdır. İslam ümmətinin hər bir fərdi elmdən agah olsa, ixtilafı yox etməyə qadir olub İslam dininin düşmənlərini tanıyıb, onların məkr və hiylələrinə aldanmazlar. Ey İslam ümməti, ey Məhəmməd ümməti, qəflət yuxusuna dalıb aləmdən bixəbər məzhəb ixtilafına düşüb məzhəb savaşı ilə məşğul olub bir-birinizi təkfir edib hər tayfa özünüzü xilas ol-

muş qrup adlandırırsınız. Bir baş qaldırıb aləmə fikir verin. Digər müxtəlif millətlərə baxıb onlardan ibrət götürün. Aləm elm nuru ilə aydınlanıb İslam dininin əsası elm ilə bərpa olmuşkən, İslam ümməti məzhəb ixtilafına düçar olduğundan cəhalət və nadanlıq onları əhatə edibdir. Uca peyğəmbərimizin buyruğuna görə *"Müsəlmanlar tək əldir,"* - hədisi-şərifinə əməl edib məzhəb ixtilafını yox edib əhatəedici kəlmənin - İslamın əhatəsinə daxil olun. Allahın Rəsulundan sonra "raşid" (doğru) xəlifələr dövrünə baxıb fikir verin. Müxtəlif millətlərdən mütəşəkkil olan İslam cəmiyyəti onların ixtilaf artıran və ixtilaflı təbiətlərinə baxmayaraq, həmin İslam kəlməsinin altında ədalət və insafı onların arasında mühafizə və bərqərar edib rəis və işçiləri, sahibkar və xidmətçiləri şəriət sahibi qərar verən qanuna uyğun insanlıq hüququnu bəşəriyyətdə bərabər və hər bir bağdan azad ümumi azadlıq ilə yola verib gecə və gündüz İslam dininin möhkəmlənməsi üçün çalışırdılar. Əgər bir cüzi məsələdə ixtilaf zühura gəlsəydi, dərhal: *"onların arasındakı işlər şura illədir,"* -mübarək ayəsinin şərtincə şuranı (məclis) bərpa edib o ixtilafı ən gözəl tədbirlə aradan götürüb ümmət arasındakı ixtilafı dindən xilas edirdilər. Hətta Qurani-Şərifin kəlmələrində zühura gələn qiraət ixtilafında, hansı ki mübarək ayənin mənalarına ondan heç bir zərər gəlməzdi, o barədə III xəlifə Osman ibn Əffan təfəkkür edib əgər qiraət ixtilafından, məsələn, millətə zahirən zərəri dəyməsin deyə, onun qaldırılmasına çalışıb bu günkü gündə də İslam ümməti arasında davam edən Qurani-Şərifin qiraətinə qərar verdi. Məsələn, Fatihə surəsində bir qrup məlik, digər qrup "maliki yəvmid-din" qiraət etməsinlər. Əgər mənada heç bir fərq olmasa da, xalqı Allah-Təaladan gələn "malik" sözünü qiraət etməyə məcbur edib digər sözün tərk edilməsini əmr etdi.

Əlbəttə, hər bir zamanda gərək bir din hamisi və din dərdini çəkən olsun, ki, millət arasında zühur edən din ixtilafını sakitləşdirməyə başlayıb dərhal odu və onun kül içində qalan qorunu da doğru-dürüst söndürsün. Olmasın ki, başqa bir zaman şölələnib yenidən millət arasında ixtilaf zühur etsin. İslamın ilk dövrlərində din hamilərinin əməlləri bu yöndə idi. Əli ibn Əbu Talibin xilafəti zamanında neçə tərəfdən ixtilaflar zühura gəldi: (Cəməl, Sıffin, Xəvaric). Onların ixtilafları nəfsin istəklərinə söykənib İslam dininin zəifləməsinə səbəb olduğu üçün

Əli cənabları onlarla müharibəyə başladı. Əvvəlcə dəfələrlə onlara millət arasına fitnə və ixtilaf salmağı qadağan etdi, o zaman ki qəbul olunmadı, məcburən iş savaşla nəticələndi. Bu mətləbə dəlil Cəməl savaşının keyfiyyətidir. O zaman ki, Cəməl savaşında Təlha, Zübeyr öldürüldü və Cəməl qoşunu məğlub oldu. Əli cənablarının fərmanı ilə Aişə həzrətlərini tam bir ehtiramla qardaşı Məhəmməd ibn Əbu Bəkrə tapşırıb ondan ötrü təyin olunan evinə aparıb sakit etdi. O cənabın əsgərləri dedilər: "Gərək, biz bu Cəməl əhlinin mallarını qarət edib özlərini də qul və kənizlik üçün əsir edək. Çünki bu cihaddır. Cihadın da hökmü belədir". Əli cənabları buyurdular: Xeyr, bu cihad deyil. Bəlkə mübarək ayənin hökmünə əsasən iki müsəlman qrupun arasında ixtilaf zühur edən zamanda əvvəlcə onların arasını islah etmək lazımdır. O zaman ki, bir tərəf zorbalıq edib islah etmək mümkün olmadı, o zaman zalım tərəfi dəf etmək lazım ki, itaət məqamına gəlib ixtilafı tərk etsinlər. Bu camaat müslümandır, indi itaət ediblər. Nə onların malları halal deyil, nə də onları qul və kəniz etmək caiz deyildir". Camaat bu sözləri qəbul etməyib öz dediklərində israr etdi. O cənab buyurdu: "İndi ki qəbul etmirsiniz, Aişəni özünə kəniz tutan kimdir?" Hamısı dedi:, - heç vaxt onu kəniz tutmaq olmaz, Allahın Rəsulunun xanımı və möminlərin anasıdır". Buyurdu: "Onu kəniz tutmaq caiz olmayanda digərlərini də qul və kəniz etmək caiz olmaz. Çünki hamısı birlikdə dava ediblər". Ondan sonra xalq o cənabın sözünə razı oldu və ancaq o cənabın zamanında zühur edən savaşlara ixtilafı yox etmək səbəbindən başqa bir səbəb göstərilsə, hamısı mənasız və çirkin səbəblərdir. O zaman ki, "raşid" xəlifələr dövrü bitdi, fitnəçi və faizçi şəxslər zühura gəlib İslam rəhbərliyinə iddia edib ixtilafı yox etmək əvəzinə öz məramlarına çatmaqdan ötrü qəsdən İslam ümmətinin arasına ixtilaf salıb bölük-bölük edib arzu və məqsədlərinə çatdılar.

Bu ixtilafın başlanğıcı bəzi Əməvi xəlifələrinin zamanından başlayaraq zühura gəldi ki, cümə namazının xütbəsində Allah-Təalaya həmd (şükür) edib hörmətli peyğəmbərə salavat və salamdan sonra Əli ibn Əbu Talib cənabına Əbu Turab adı ilə söyməyi və lənət etməyi minbərlərdə İslam ümməti arasında bidət (mənfi yenilik) qoyub əməl etməyənin qətlinə hökm verirdilər. 80 il Əməvi xilafətində bu iş belə davam etdi. Ancaq 3 ildən

az bir zaman içində Ömər ibn Əbdüləziz özünün ana tərəfdən babası olan Ömər ibn Xəttab kimi ədalət sifətinə sahib olub Əli cənablarının söyülməsini və lənət edilməsini tərk etməyi əmr etdi. Ondan sonra zamanın keçməsi ilə iş dəyişib müsəlmanlar bu çirkin əməllərin başlanğıcını qoyan şəxslərin özünü söyüb lənət etməyə başladılar. Bu cahil əməl artdıqca bəzi Əməvilərdən başqa bəzi İslam rəhbərlərinə də saldırıb söyməyə və lənət etməyə başladılar. Görəsən bunların hansına haqq və hansına haqsız demək olar? Getdikcə məzhəb çəkişməsi artıb cəhalət möhkəmlənib islam ümməti birlikdən sonra bölük-bölük, pərən-pərən olub, hər bir işdən əl çəkib, ancaq özlərinin axirət aqibətindən nicat tapmalarını bir-birilərini küfr və zındıqlıqla isnad etməkdə görüb savaş ilə məşğul oldular.

Allaha şükür, bu son mərifətli dövrdə İslam ümmətinin gözlərinin qabağından cəhalət pərdəsi götürülüb, hamısı işin həqiqətindən agah oldular. İndi biz İslam ümmətinə əvvəlcə elm lazımdır. O zaman ki, millət elm sahibi oldu, keçmiş cahillərin əkdiyi toxumların kökünü elm qüvvəsi ilə qoparıb onun yerində yaxşılıq ağacı, ittihad və ittifaq toxumunu əkmək asan surətdə meydana gələr. Əsl mətləb işin həqiqətinə agah olmaqdır. O zaman ki Qurani-Şərifin uca məzmunu dərk olunub avam camaat arasında yayıldı, xalq özü yavaş-yavaş elmə meyil edər. Elmin şirinliyi onların duyğularına təsir etdikdə elmdən əl çəkməyib övlad və qohumlarını da elm təhsil etməyə rəğbətləndirərlər. O səbəbdən islamın ilk dövrlərində ucalan islamın birliyi bayrağı yenidən ucalıb islamın əvvəlki halının geri dönməsi kəsinləşər.

*Elmdir nicat yolunun baisi,*
*Elmdir həyat yolunun baisi.*
*Hər gədə və yoxsulu elm və hökm,*
*Eyləyər bütün qullara ağa.*
*Müvəffəqiyyət və xeyir verən Odur.*

# تفسیر
# کشف الحقائق
# عن نکت الآیات
# والدقائق

ترجمه‌سی
وصحافلرده مشهور
معارف‌پرور جناب حاجی [illegible]
العالی [illegible]
اهتمامیله چاپ
اولنوبدر

**Təfsiru Kəşfil-Həqayiq an Nükətil-Ayəti vəd-Dəqayiq**

Sərvət və səxavəti ilə məşhur maarifpərvər cənab Hacı Zeynalabidin Tağıyevin ianə və ihtimamilə çap olunmuşdur

## ər-RUM SURƏSİ

30-cu surədir. Mədinədə nazil olub, 60 ayə, 819 kəlmə və 3534 hərfdir.

بِسْمِ اللّٰهِ الرَّحْمَنِ الرَّحِيمِ. الٓمٓ ﴿١﴾ غُلِبَتِ الرُّومُ ﴿٢﴾ فِيٓ اَدْنَى الْاَرْضِ وَهُمْ مِنْ بَعْدِ غَلَبِهِمْ سَيَغْلِبُونَ ﴿٣﴾ فِي بِضْعِ سِنِينَ لِلّٰهِ الْاَمْرُ مِنْ قَبْلُ وَمِنْ بَعْدُ

---

**Bismillahir-rəhmanir-rəhim**

**1) (الٓمٓ) - bu mübarək surənin adıdır. Lakin adətən ona Rum surəsi deyilir. Rum** (Bizans) **xalqı fars** (İran) **xalqı ilə Şamda** (Bəsrə) **ərəblərə yaxın yerdə mücadilə edib farslar rumlara qalib gəldi. Bu savaş zamanı uca peyğəmbərimiz Məkkədə olub hələ Mədinəyə hicrət** (köç) **etməmişdi. Bu xəbər Məkkə əhlinə yetişdi. Rumlar kitab əhli** (xristian), **farslar atəşpərəst olduğu üçün uca peyğəmbər və onun səhabəsi farsların rumlara qalib gəlməyindən qəmgin olub Məkkə əhli olan müşriklər şad oldular. Məkkə müşrikləri müsəlmanlara dedilər: "Siz və xristianlar kitab əhlisiniz, biz və fars əhli kitabımız olmadığı üçün bərabərik. Bizim qardaşlarımız olan fars xalqı sizin qardaşlarınız olan kitab əhlinə qalib gəldilər. Biz də, əlbəttə sizə qalib gələcəyik.** (O vaxt bu mübarək ayə endirildi)".

**2-3) (غُلِبَتِ الرُّومُ) - Rum xalqı farslarla savaşıb əgər rumlar məğlub olsalar da, (وَهُمْ مِنْ بَعْدِ غَلَبِهِمْ سَيَغْلِبُونَ فِي بِضْعِ سِنِينَ) - lakin rum xalqı farslarla savaşda məğlub olandan sonra 3 il ilə 9 il arasında yenidən savaşıb farslara qalib gələcəklər.**

**4-5) (لِلّٰهِ الْاَمْرُ مِنْ قَبْلُ وَمِنْ بَعْدُ) - Rumlar farslara qalib olmaqdan əvvəl** (rumlar məğlub olan vaxtda) **və fars məğlub olandan sonra** (Rumlar farslara qalib olan vaxtda) **hər iki* vaxtda qalib və məğlub olmaq Allah-Təalanın əmri və iradəsi ilədir.**

*(*Qeyd: "Hər bir savaşda qələbə Allah-Təalanın iradəsinə bağlıdır. Az camaatı çoxluğa qalib edər. Hər bir xalq ki, onların arasında zülm yayılar, Allah-Təala onları məğlub edər, belə ki, ağıllanıb zülmü tərk etsinlər. Zülm çirkin sifətlərdəndir. Zalım olan millət və xalq həmişə zəlil olar. Aləmin təbiəti bu yöndədir. İbrət alan şəxslər bu mətləbdən qafil deyildir. Bugünkü gündə islam ümmətini fəlakətə salan onların arasında bərqərar olan zülmdür. İslam dövlətlərində ədalət əvəzinə zülm qanun olub onu xalq arasında yayıb özlərini islam dininə inanan hesab edirlər. Kənardan baxan digər millətlərin cahilləri*

وَيَوْمَئِذٍ يَفْرَحُ الْمُؤْمِنُونَ ﴿٤﴾ بِنَصْرِ اللّٰهِ يَنْصُرُ مَنْ يَشَآءُ وَهُوَ الْعَزِيزُ الرَّحِيمُ ﴿٥﴾ وَعْدَ اللّٰهِ لَا يُخْلِفُ اللّٰهُ وَعْدَه وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ ﴿٦﴾

---

*o zülmləri islam dinin özündə var olan qanun sayıb islam dininə tənə edirlər. Amma bixəbərdirlər ki, islam dininin əsli və əsası Qurani-Şərifdir. Qurani-Şərifi tərk edib onun ehkamından üz çevirmək o zülmlərin bəzi islam millətləri arasında zühuruna bais olubdur. Digər millətlərin qanun və ehkamlarının əksəriyyətinə fikir verin ki, Qurani-Şərifdən götürülməsi gün kimi açıq-aşkardır. İslam dinində elmsiz xəbərlərin və qeyri-mötəbər kitabların yayılması Qurani-Şərifin tərk edilməsinə bais olubdur. İslam ümmətinin rəhbərlərinin bu mətləbə diqqət etmələri mütləq fərzdir).*

**(وَيَوْمَئِذٍ يَفْرَحُ الْمُؤْمِنُونَ بِنَصْرِ اللّٰهِ) - Allah-Təalanın vədi doğru olub rumlar farslara qalib olan gündə Allah-Təalanın kitab əhlinə - rumlara kömək etməsinə şad oldular.**

**(يَنْصُرُ مَنْ يَشَآءُ) - Allah-Təala hər bir şəxsə özü istəyərsə, kömək edər. Necə ki rumlara kömək olub onları farslara qalib etdi. (وَهُوَ الْعَزِيزُ الرَّحِيمُ) - Allah-Təala öz məxluquna qalibdir. Siz möminləri gah qalib və gah məğlub edər. Ən sonda möminlərə rəhm edib onları müşriklərə qalib edəcəkdir. (O zaman ki bu mübarək ayə gəldi, Əbu Bəkir müşriklərə dedi: “Allah-Təala sizin gözlərinizi nurlandırmasın, and olsun Allah-Təalaya, neçə ildən sonra rumlar farslara qalib olacaqdır”. Übeyy ibn Xələf Əbu Bəkrə dedi: “Yalan dedin, gəl bu vaxtı müəyyənləşdirib girov qoyub şərt kəsək”. Üç il vaxt qoyub on dəvəyə şərt kəsdilər. Əgər üç ilə kimi rumlar farslara qalib gəlsə, Übeyy ibn Xələf on dəvə Əbu Bəkrə versin. Əgər qalib olmasa, Əbu Bəkir on dəvə versin. Əbu Bəkir gedib bu mətləbi Allahın Rəsuluna xəbər verdi. Peyğəmbər buyurdu: “Mübarək ayədə vaqe olan** (bid`) **sözü üç ilə doqquzun arasına işarədir. Gedib girovu və vaxtın hər ikisini artır”. Əbu Bəkir Əbi Xələfin yanına getdi. Doqquz ilə kimi yüz dəvəyə şərt kəsdilər. Ondan sonra Allahın Rəsulu Mədinəyə hicrət etdi. Uhud savaşında peyğəmbərin atdığı nizə ilə Übeyy ibn Xələfin boynu yaralanıb bu yaradan həlak oldu.** (Bu mətləb kitabın I cildində Uhud savaşının bəhsində göstərilibdir). **Yeddi ildən sonra rumlar farslara qalib gəldi. Əbu Bəkir gedib, Übeyy ibn Xələfin varislərindən yüz dəvəni alıb, peyğəmbərin yanına gətirdi. Peyğəmbərin əmri ilə Əbu Bəkir o yüz dəvəni sədəqə verdi.** (Bu mübarək ayə Allahın Rəsulunun peyğəmbərliyinə və Qurani-Şərifin Allah-Təala tərəfindən gəlməsinə böyük bir dəlildir).

**6) (وَعْدَ اللّٰهِ) - Rumların farslara qalib olma vədi haqq olan vəddir. Allah-Təala bu vədi verir. (لَا يُخْلِفُ اللّٰهُ وَعْدَهُ) - Allah-Təala vədinə xilaf çıxmaz. Allah-Təalanın hər bir vədi haqdır və vaqe olacaqdır.**

يَعْلَمُونَ ظَاهِرًا مِنَ الْحَيٰوةِ الدُّنْيَاۚ وَهُمْ عَنِ الْاٰخِرَةِ هُمْ غَافِلُونَ ﴿٧﴾ اَوَلَمْ يَتَفَكَّرُوا فٖٓي اَنْفُسِهِمْ
مَا خَلَقَ اللّٰهُ السَّمٰوَاتِ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَٓا اِلَّا بِالْحَقِّ وَاَجَلٍ مُسَمًّىۜ وَاِنَّ كَثٖيرًا مِنَ النَّاسِ بِلِقَٓائِ
رَبِّهِمْ لَكَافِرُونَ ﴿٨﴾ اَوَلَمْ يَسٖيرُوا فِي الْاَرْضِ فَيَنْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الَّذٖينَ مِنْ قَبْلِهِمْۜ كَانُوٓا
اَشَدَّ مِنْهُمْ قُوَّةً كَانُوٓا اَشَدَّ مِنْهُمْ قُوَّةً

---

**(وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ) - Lakin xalqın əksəriyyəti Allah-Təalanın vədinin doğruluğundan və vədinə xilaf çıxmamasından xəbərdar olmayıb Allah-Təalanın vədini qəbul etmir.**

**7) (يَعْلَمُونَ ظَاهِرًا مِنَ الْحَيٰوةِ الدُّنْيَاۚ) - İnsanların əksəriyyəti maarif və vacib işlərdən heç birinə agah deyildir. Lakin dünya həyatının* zahirinə** (yemək, içməkdən ləzzət almaq) **agahdırlar. Amma dünyanın batini nədir, Allah-Təala onda nə hikmətlər bərqərar edib onlardan heç bir şey dərk etmirlər, (وَهُمْ عَنِ الْاٰخِرَةِ هُمْ غَافِلُونَ) - və xalqın əksəriyyəti axirət işlərindən qafildir.**

*(*Qeyd: "Mübarək ayə buna dəlildir ki, dünyanın zahirindən keçib batininə fikir vermək lazımdır. Dünyanın batini dünyada olan şeylərdə bərqərar verilən xüsusiyyətlərdən ibarətdir. Təbiət və sənət elmlərində bir şəxs kamil bir dərəcəyə çatmasa, dünyadakı şeylərin xüsusiyyətini dərk edə bilməz. Ar olsun islam əhlinə ki, belə açıq-aydın ayələrdən qafil olub təbiət və sənət elmlərinin təhsilini tərk edib əkinçilik və muzdurluqla kifayətləniblər. Qurani-Şərifə fikir verib diqqət edənlər açıq-aydın ayələrin ehtiva etdiyi rəmz və incəliklərdən faydalananlardır. Qurani-Şərif nəinki təkcə axirət, bəlkə, dünya işlərində də hidayət etdirəndir).*

**8) (اَوَلَمْ يَتَفَكَّرُوا فٖٓي اَنْفُسِهِمْ مَا خَلَقَ اللّٰهُ السَّمٰوَاتِ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَٓا اِلَّا بِالْحَقِّ وَاَجَلٍ مُسَمًّىۜ) - Görəsən, Adəm oğlu öz nəfsinə fikir vermir ki, Allah-Təala göyləri və yeri, onların arasındakı hər bir qisim məxluqu batil və əbəs yerə yaratmayıb, bəlkə haqq və hikmət, doğru bir məqsəd üzrə müəyyən bir vaxta qədər yaradıbdır. Nə vaxt ki, o müəyyən vaxt yetişdi, ömürləri sona çatıb, dünya fani olub xalq haqq-hesabdan ötrü Allah-Təala tərəfinə qayıdacaqdır. (وَاِنَّ كَثٖيرًا مِنَ النَّاسِ بِلِقَٓائِ رَبِّهِمْ لَكَافِرُونَ) - Və həqiqət üzrə o müəyyən vaxtın yetişib Allah-Təalanın rəhmət və qəzəbini görməyə inanmayıb kafirdirlər.**

**9) (اَوَلَمْ يَسٖيرُوا فِي الْاَرْضِ فَيَنْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الَّذٖينَ مِنْ قَبْلِهِمْ) - Görəsən, Adəm övladı niyə səfərə çıxıb yer üzünü seyr etmir? Belə ki, onlardan əvvəl yaşayan* zalım camaatların sonunun necə olduğunu görsün.** (İndi də Dəməşqlə Mədinə arasında Ad və Səmud camaatının izləri yaşayır. Allah-Təala onları həlak edib əsərləri ibrətlə baxılmaq üçün qalıbdır). **Onlara baxıb bir ibrət alsınlar. (كَانُوٓا اَشَدَّ مِنْهُمْ قُوَّةً) -** (Ey Məhəmməd), **əvvəl**

وَاَثَارُوا الْاَرْضَ وَعَمَرُوهَآ اَكْثَرَ مِمَّا عَمَرُوهَا وَجَآءَتْهُمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ فَمَا كَانَ اللّٰهُ لِيَظْلِمَهُمْ
وَلٰكِنْ كَانُوٓا اَنْفُسَهُمْ يَظْلِمُونَ ﴿٩﴾ ثُمَّ كَانَ عَاقِبَةَ الَّذِينَ اَسَآؤُا السُّوٓاٰىٓ اَنْ كَذَّبُوا بِاٰيَاتِ اللّٰهِ وَكَانُوا
بِهَا يَسْتَهْزِؤُنَ ﴿١٠﴾ اَللّٰهُ يَبْدَؤُا الْخَلْقَ ثُمَّ يُعِيدُهُ ثُمَّ اِلَيْهِ تُرْجَعُونَ ﴿١١﴾ وَيَوْمَ تَقُومُ السَّاعَةُ يُبْلِسُ
الْمُجْرِمُونَ ﴿١٢﴾

---

**yaşayan zalımlar ki, Allah-Təala onlara əzab göndərib hamısını həlak etdi, səni yalanlayıb Allah-Təalaya itaət etməyən bu zalımlardan qüvvət və qüdrət olaraq daha üstündürlər. Bunlar necə xilas olacaq?** (وَاَثَارُوا الْاَرْضَ وَعَمَرُوهَآ اَكْثَرَ مِمَّا عَمَرُوهَآ) **- Əvvəllər yaşayanlar yer üzündə hər bir qisim əkinçiliklə məşğul olub bunlardan daha çox yer üzünü təmir edib möhkəm binalar tikdilər. Görəsən, onlara bir fayda verib onları Allah-Təalanın əzabından qorudumu? (**وَجَآءَتْهُمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ**) - O camaatların peyğəmbərləri Allah-Təala tərəfindən doğruluqlarına dəlil olan möcüzələrlə gəldilər. Peyğəmbərlərə iman etmədilər və bu səbəbdən Allah-Təala onları həlak etdi.**

*(*Qeyd: Zülm bir çirkin işdir, edən həmişə günahkardır. Hər bir zamanda Allah-Təala dünyada zalımlardan intiqam alar, amma bizdə doğru nəzərlə baxıb ibrət alan göz yoxdur. Əgər dürüst diqqət edilsə, bizim dövrdə məzluma zülm edən zalımlardan Allah-Təalanın intiqam aldığını, amma bizim qəflət içində olub xəbərdar olmadığımız görünər).*

**(**فَمَا كَانَ اللّٰهُ لِيَظْلِمَهُمْ**) - Allah-Təala onları həlak etməklə onlara zülm etmədi.** (وَلٰكِنْ كَانُوٓا اَنْفُسَهُمْ يَظْلِمُونَ) **Lakin onlar Allah-Təalanın itaətindən çıxıb öz nəfslərinə zülm etdikləri üçün həlak olmalarına səbəb oldular.**

**10) (**ثُمَّ كَانَ عَاقِبَةَ الَّذِينَ اَسَآؤُا السُّوٓاٰىٓ**) – Allah-Təala zalımları dünyada həlak edəndən sonra onların aqibəti belə olacaqdır ki, Allah-Təala əzabların ən yamanına və şiddətlisinə onları düçar edib həmişə əzab içində qalacaqlar. (**اَنْ كَذَّبُوا بِاٰيَاتِ اللّٰهِ وَكَانُوا بِهَا يَسْتَهْزِؤُنَ**) - O cəhətə görə, onlara əzab olacaqdır ki, Allah-Təalanın öz peyğəmbərlərinin doğruluğuna dəlil və sübut olan əlamətlərini inkar edib onlara istehza edirdilər.** (Necə ki Qurani-Şərifi təkzib edib istehza etdilər, halbuki Qurani-Şərifin haqq olmağı fikir və təfəkkür edən şüur sahiblərindən ötrü açıq-aşkardır).

**11) (**اَللّٰهُ يَبْدَؤُا الْخَلْقَ ثُمَّ يُعِيدُهُ ثُمَّ اِلَيْهِ تُرْجَعُونَ**) - Allah-Təala öz kamil qüdrəti ilə xalqı yoxdan yaradır, ölәndən sonra yenidən həyata geri gətirir, həyat verəndən sonra hamınız hesab verməkdən ötrü Allah-Təala tərəfinə qayıdacaqsınız.** (O vaxt Allah-Təala öz intiqamından başqa, hər bir məzlumun intiqamını da zalımlardan alacaq).

وَلَمْ يَكُنْ لَهُمْ مِنْ شُرَكَآئِهِمْ شُفَعٰؤُٓا وَكَانُوا بِشُرَكَآئِهِمْ كَافِرِينَ ﴿١٣﴾ وَيَوْمَ تَقُومُ السَّاعَةُ يَوْمَئِذٍ يَتَفَرَّقُونَ ﴿١٤﴾ فَاَمَّا الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ فَهُمْ فِي رَوْضَةٍ يُحْبَرُونَ ﴿١٥﴾

---

**12)** (وَيَوْمَ تَقُومُ السَّاعَةُ يُبْلِسُ الْمُجْرِمُونَ) – **O gündə ki qiyamət vaqe olar, Allah-Təalanın qəhr və qəzəbindən müşriklər, zalımlar və fasiqlər sakit və heyrət içində qalıb əzabı özlərindən qaldırmağa heç bir dəlil tapmayıb danışmağa da qadir olmazlar.**

**13)** (وَلَمْ يَكُنْ لَهُمْ مِنْ شُرَكَآئِهِمْ شُفَعٰؤُٓا) – **Qiyamət günündə müşriklərdən ötrü dünyada Allah-Təalaya şirk qoşan müşriklərdən heç birinə şəfaət edən** (günahlarını bağışlamağı xahiş edən) **olmaz.** (halbuki onlarda şəfaətə ümid vardır). (وَكَانُوا بِشُرَكَآئِهِمْ كَافِرِينَ) **Qiyamət günündə o müşriklərə şəfaət olmayacağı üçün onları inkar edib onlardan uzaq durarlar.** (bu mübarək ayə cahilcəsinə şəfaət ümidində olanların ümid və istəyini yox edir, təfəkkür edilsin).

**14)** (وَيَوْمَ تَقُومُ السَّاعَةُ يَوْمَئِذٍ يَتَفَرَّقُونَ) **- O gündə ki qiyamət vaqe olar, ogünkü gündə hesab verəndən sonra möminlər və kafirlər bir-birindən aralanıb möminlər əbədi nemət içində, kafirlər əbədi əzabda qalıb heç vaxt bir-biriləri ilə görüşməyəcəklər.**

**15) (فَاَمَّا الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ فَهُمْ فِي رَوْضَةٍ يُحْبَرُونَ) - Amma o şəxslər ki, dünyada Allah-Təalaya iman gətirib yaxşı və gözəl bağda olar, o bağda onlardan ötrü heç bir qəm və qüssə olmayıb*, şad və xürrəm olarlar.**

*(***Qeyd:** Təfsirçilərdən Vəki deyibdir: "Cənnət əhlinin cənnətdə şad və xürrəm olması gözəl səslər və gözəl nəğmələr eşitməyə şad olmaları səbəbindəndir. Bir gün möhtərəm peyğəmbərimiz cənnət və onda olan nemətlərdən bəhs etdi. Camaatın içində bir bədəvi var idi, soruşdu: "Ey peyğəmbər, görəsən, cənnətdə gözəl səs və gözəl nemətlər varmı?" Allah Rəsulu buyurdu: "Bəli, cənnətdə bir çay var, onun ətrafında bakirə qızlar gözəl səslə nəğmə oxuyarlar ki, o səslərin oxşarını heç kim dünyada əbədiyyətə qədər eşitməyəcək". Bu hədisi bəzi üləma dünyada nəğmənin halal olmasına dəlil sayıblar və bundan başqa da nəğmənin halallığı haqqında Allah Rəsulundan bir çox hədislər nəql edilibdir. (Buxari, İydeyn, 2; Müslüm, İydeyn, 19-22) Necə ki yemək bədəndən ötrü qidadır, habelə gözəl səs də ruhdan ötrü bir qidadır ki, heç bir şey onun kimi ruh üçün qida ola bilməz. Amma belə böyük ləzzətli bir şeyə bir qrup İslam alimi mütləq haram deyiblər, hətta Qurani-Şərifin də haram saydığını deyiblər. Nəğməni mütləq halal, ya da mütləq haram saymağın heç biri doğru deyil. Bəlkə, səsin özündə də heç bir haramlıq yoxdur. Halal və haram məqamı söz və şeir məclisi ilə olar. Dini bir məclis, ya da hər hansı bir dildə hikmətamiz şeirlər olsa, ya da Qurani-Şərif nəğmə kimi oxunsa, şübhəsiz ki, halaldır. Amma fasiqlərin məclisində içki olsa, çirkin və batil şeirlər oxunsa,*

وَاَمَّا الَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِاٰيَاتِنَا وَلِقَٓائِ الْاٰخِرَةِ فَاُولٰٓئِكَ فِي الْعَذَابِ مُحْضَرُونَ﴿١٦﴾ فَسُبْحَانَ اللّٰهِ
حِينَ تُمْسُونَ وَحِينَ تُصْبِحُونَ ﴿١٧﴾ وَلَهُ الْحَمْدُ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ وَعَشِيًّا وَحِينَ تُظْهِرُونَ
﴿١٨﴾ يُخْرِجُ الْحَيَّ مِنَ الْمَيِّتِ وَيُخْرِجُ الْمَيِّتَ مِنَ الْحَيِّ

---

*haramdır. Amma səsin özünə haram demək çirkin və məntiqsiz sözdür. Çünki səsin gözəl və ya çirkin olması şəxsin öz ixtiyarı ilə deyildir. Bəlkə, gözəl səs Allah-Təalanın bəxş etdiyi böyük bir nemətdir. Necə demək olar ki, belə böyük bir nemət haramdır. Bəli, o böyük neməti günah məqamında işlədəndə haram olar. Bu da bir səsə məxsus deyildir. Bəlkə, hər bir neməti ki, Allah-Təala insana bəxş edib, o neməti Allah-Təalanın razı olmadığı məqamda işlətmək haramdır. Məsələn, dil böyük bir nemətdir. Allah-Təala insana bəxş edib insan onunla heyvanatdan fərqlənib özünü izah edir, əgər insan bu neməti lazım olmayan yerdə işlədib xalqa ədəbsizlik edib, çirkin sözlər danışsa, o vaxt haram iş görüb onun o danışmağı haram olar. Belədir nəğmənin hökmü. Bizim islam alimlərinin əksəriyyəti tarix elmindən xəbərsiz olub, əgər islam tarixinə agah olsaydılar, o vaxt onlardan ötrü bu mətləbin haqq olmağı zahir olardı. Uca qadın Səkinə Hüseyn ibn Əli (ə.s) qızının (hansı ki mərsiyəxanlar onun 3 yaşında Dəməşqdə öldüyünü deyirlər) tarix əhvalatına agah olanlara bu mətləb daha çox aydın olar. Bu mətləbə irad tutanlar əvvəlcə gedib tarix elmini öyrənsinlər, ondan sonra bu mətləbin gözəl və ya çirkin olmağını dərk edə bilərlər. Müvəffəqiyyəti verən Allahdır).*

**16) (وَاَمَّا الَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِاٰيَاتِنَا وَلِقَٓائِ الْاٰخِرَةِ) - Amma o şəxslər ki, Allah-Təalaya kafir olub bizim peyğəmbərlərin doğruluğuna sübut olan dəlilləri və axirət günündə bizim rəhmət və qəzəbimizlə görüşməyi təkzib edirlər, (فَاُولٰٓئِكَ فِي الْعَذَابِ مُحْضَرُونَ) - Əlbəttə, onlar axirət əzabına hazırlanıb, əzab onlardan yüngülləşməyib, heç vaxt əzabdan məhrum olmazlar.**

**17) (فَسُبْحَانَ اللّٰهِ حِينَ تُمْسُونَ) - Allah-Təalanı hər bir eyib və nöqsandan pak və uzaq sayaraq onu zikr edin. Axşam vaxtına daxil olduğunuz halda (وَحِينَ تُصْبِحُونَ) - bir də sabah vaxtına daxil olduğunuz halda** (hər bir vaxtda Allah-Təalanı zikr etmək lazımdır, xüsusən, bu iki vaxtda).

**18) (وَلَهُ الْحَمْدُ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ) - Göylərdə və yerdə məxluqatın həmd-sənası Allah-Təalaya məxsusdur. (وَعَشِيًّا وَحِينَ تُظْهِرُونَ) - Bir də Allah-Təalanı gecə qaranlıq** (şam) **vaxtında zikr edin və bir də zöhr vaxtına daxil olduğunuz halda zikr edin.** (İbn Abbas deyibdir: “Bəhs olunan vaxtlarda Allah-Təalanı zikr etmək o vaxtlarda namaz qılmaqdan ibarətdir).

**19) (يُخْرِجُ الْحَيَّ مِنَ الْمَيِّتِ) - Allah-Təalanın sifətlərindən biri də budur ki, kamil qüdrəti ilə dirini ölüdən** (insanı və heyvanı spermadan və yumurtadan) **çıxarır. (وَيُخْرِجُ الْمَيِّتَ مِنَ الْحَيِّ) - Və Allah-Təala ölünü** (spermanı və yumurtanı)

وَيُحْيِ الْاَرْضَ بَعْدَ مَوْتِهَاؕ وَكَذٰلِكَ تُخْرَجُونَ ﴿١٩﴾ وَمِنْ اٰيَاتِهٖٓ اَنْ خَلَقَكُمْ مِنْ تُرَابٍ ثُمَّ اِذَٓا اَنْتُمْ
بَشَرٌ تَنْتَشِرُونَ ﴿٢٠﴾ وَمِنْ اٰيَاتِهٖٓ اَنْ خَلَقَ لَكُمْ مِنْ اَنْفُسِكُمْ اَزْوَاجًا لِتَسْكُنُوٓا اِلَيْهَا وَجَعَلَ بَيْنَكُمْ
مَوَدَّةً وَرَحْمَةًؕ اِنَّ فٖي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَتَفَكَّرُونَ ﴿٢١﴾ وَمِنْ اٰيَاتِهٖ خَلْقُ السَّمٰوَاتِ وَالْاَرْضِ

---

**diridən çıxarır. (وَيُحْيِ الْاَرْضَ بَعْدَ مَوْتِهَاؕ) - Yer öləndən sonra** (ot-ələf quruyub təzəliyi gedəndən sonra) **onda ot-ələfi göyərdib təptəzəlik verib onu dirildir.** (Bu işlər hamısı Allah-Təalaya xasdır və Allah-Təala onlara qadirdir)**. (وَكَذٰلِكَ تُخْرَجُونَ) - Ot-ələfi yerdən çıxarıb yerə həyat verən kimi Allah-Təala qiyamət günündə hesab verməkdən ötrü siz insan nəslinə də həyat verib yerdən çıxaracaqdır.** (Bu bəhs olunan əlamətlərlə Allah-Təalanın kamil qüdrətini görəndən sonra daha qiyamət günündə dirilməyi inkar etməyək). **Bundan sonra növbəti ayələrdə Allah-Təala öz kamil qüdrətinə dəlil olan ayələri bir-bir bəyan edir.**

**20) (وَمِنْ اٰيَاتِهٖٓ اَنْ خَلَقَكُمْ مِنْ تُرَابٍ) - Allah-Təalanın kamil qüdrətinə işarə olan dəlil və sübutlardan biri budur ki, sizin babanız Adəmi, sizi də onun nəslindən torpaqdan yaratdı.** (Bu qüdrət sahibi Allah-Təaladan başqa kim ola bilər?) **(ثُمَّ اِذَٓا اَنْتُمْ بَشَرٌ تَنْتَشِرُونَ) -Allah-Təala sizi torpaqdan yaradandan sonra o zaman ki, bəşər surətinə daxil olub insan oldunuz, o vaxt yer üzünə yayılıb Allah-Təalanın yer üzündə qərar verdiyi şeylərdən mənfəət qazandınız.**

**21-22) (وَمِنْ اٰيَاتِهٖٓ اَنْ خَلَقَ لَكُمْ مِنْ اَنْفُسِكُمْ اَزْوَاجًا لِتَسْكُنُوٓا اِلَيْهَا) - Yenə Allah-Təalanın kamil qüdrətinə və hər bir əməlin ondan hikmət üzrə yaranmasına işarə olan dəlil və sübutlardan biri də odur ki, siz kişi tayfasından ötrü öz nəfsinizin cinsindən cütlər** (arvadlar) **yaratdı. Ta ki onlara meyil edib öz cinsinizdən olduğu üçün onlarla qaynayıb-qarışasınız.**

**(وَجَعَلَ بَيْنَكُمْ مَوَدَّةً وَرَحْمَةً) - Allah-Təala arvadlarla sizin aranızda əvvəldən bəri bir tanışlıq və yaxınlıq olmayan halda məhəbbət və rəhməti qərar verdi. Belə ki, bir-birinizlə ünsiyyət edib sizdən yaranan insan nəsli dünyada davam etsin. (اِنَّ فٖي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَتَفَكَّرُونَ) - Bu evlilik işində** (ər-arvadlıqda) **Allah-Təalanın qüdrət və əzəmətinə fikir verib təfəkkür edən camaatdan ötrü dəlil və sübutlar vardır.** (Həqiqətən də izdivac işində, hətta heyvanat arasında da Allah-Təalanın əzəmətinə böyük dəlil mövcuddur. O rəğbət meyli və məhəbbəti ki, iki nəfər arasında görülür, valideynlə övlad arasında və ya digər qohumlar arasında görülməz. Allah-Təala Adəm və Həvvanı atasız-anasız bir-biri üçün yaratması ər-arvadın bir-birinə valideynlərindən daha yaxın olmasına kafi dəlildir). **(وَمِنْ اٰيَاتِهٖ خَلْقُ السَّمٰوَاتِ وَالْاَرْضِ) - Allah-Təalanın kamil qüdrətinə işarə olan dəlil və sübutlardan biri də göylərin və yerin yaradılmasıdır ki, Allah-Təala bu böyüklükdəki məxluqatı necə yoxdan var edibdir?**

وَاخْتِلَافُ اَلْسِنَتِكُمْ وَاَلْوَانِكُمْ ۜ اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِلْعَالِمِينَ ﴿٢٢﴾ وَمِنْ اٰيَاتِهٖ مَنَامُكُمْ بِالَّيْلِ وَالنَّهَارِ
وَابْتِغَآؤُكُمْ مِنْ فَضْلِهٖ ۜ اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَسْمَعُونَ ﴿٢٣﴾ وَمِنْ اٰيَاتِهٖ يُرِيكُمُ الْبَرْقَ خَوْفًا
وَطَمَعًا وَيُنَزِّلُ مِنَ السَّمَآءِ مَآءً فَيُحْيٖي بِهِ الْاَرْضَ بَعْدَ مَوْتِهَا ۜ اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَعْقِلُونَ ﴿٢٤﴾
وَمِنْ اٰيَاتِهٖٓ اَنْ تَقُومَ السَّمَآءُ وَالْاَرْضُ بِاَمْرِهٖ ۜ ثُمَّ اِذَا دَعَاكُمْ دَعْوَةً مِنَ الْاَرْضِ اِذَآ اَنْتُمْ تَخْرُجُونَ ﴿٢٥﴾

---

(وَاخْتِلَافُ اَلْسِنَتِكُمْ وَاَلْوَانِكُمْ ۜ) - **Bir də siz insan nəslinin danışdığınız dillərinin və rənglərinin müxtəlif olmağı Allah-Təalanın qüdrətinə böyük dəlildir.** (Həqiqətən bu qədər dünyada müxtəlif dillərin heç birinin digərinə bənzər olmamasının necə olması və haradan yaranması heyrətli bir işdir. Bu mətləb dünyada həll olunmayan çətin işlərdən biridir. Bu vaxta kimi heç bir dövrün alimi bu mətləbi həll edə bilməmişdir. Əgər bu barədə danışıblarsa da, zənn və təxmin üzrə həqiqəti olmayan bir söz deyiblər). (اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِلْعَالِمِينَ) - **Bu bəhs olunan işlərdə Allah-Təalanın qüdrət və əzəmətindən agah olan şəxslərdən ötrü dəlil və sübutlar mövcuddur.**

**23)** (وَمِنْ اٰيَاتِهٖ مَنَامُكُمْ بِالَّيْلِ وَالنَّهَارِ وَابْتِغَآؤُكُمْ مِنْ فَضْلِهٖ ۜ) - **Allah-Təalanın kamil qüdrətinə işarə olan dəlil və sübutlardan biri də odur ki, gecə və gündüzdə həm sizdən ötrü yuxu, həm də məişətinizdən ötrü onun bərəkətindən ruzi istəməyi qərar veribdir.** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَسْمَعُونَ) - **Həqiqətən də bu bəhs olunan işlərdə Allah-Təalanın qüdrət və əzəmətinə eşidən və yadında saxlayıb təfəkkür edən şəxslərdən ötrü dəlil və sübutlar vardır, eşidib yadda saxlayan qulaq haradadır?**

**24)** (وَمِنْ اٰيَاتِهٖ يُرِيكُمُ الْبَرْقَ خَوْفًا وَطَمَعًا) - **Allah-Təalanın kamil qüdrətinə işarə edən dəlil və sübutlardan biri də odur ki, ildırımı sizə göstərir. İldırımı görəndə həm ondan qorxursunuz ki, düşüb sizi yandırmasın, həm sizdə yağış arzusu olur.** (وَيُنَزِّلُ مِنَ السَّمَآءِ مَآءً فَيُحْيٖي بِهِ الْاَرْضَ بَعْدَ مَوْتِهَا) - **Və Allah-Təala göydən su endirib o su səbəbinə yeri öləndən sonra dirildir.**

(اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَعْقِلُونَ) - **Həqiqətən də, bu bəhs olunan işlərdə Allah-Təalanın qüdrət və əzəmətinə ağıllı camaatdan ötrü dəlil və sübutlar vardır.**

**25)** (وَمِنْ اٰيَاتِهٖٓ اَنْ تَقُومَ السَّمَآءُ وَالْاَرْضُ بِاَمْرِهٖ ۜ) - **Allah-Təalanın kamil qüdrətinə işarə edən dəlil və sübutlardan biri də odur ki, göy, yer Allah-Təalanın əmr və iradəsi ilə dirək və sütunsuz durub Allah-Təalanın əmr və iradəsindən başqa heç bir şeyə möhtac deyildir.**

(ثُمَّ اِذَا دَعَاكُمْ دَعْوَةً مِنَ الْاَرْضِ اِذَآ اَنْتُمْ تَخْرُجُونَ) - **Bunları Allah-Təala mühafizə edəndən sonra Allah-Təalanın kamil qüdrətinə dəlil olan budur ki, o zaman ki, qiyamət günündə Allah-Təala bir dəfə sizi qəbirlərdən çağıracaq, dərhal həyata gəlib, qəbirlərdən çıxıb hesab verməkdən ötrü məhşərə hazır olarsınız.**

وَلَهُ مَنْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِۜ كُلٌّ لَهُ قَانِتُونَ ﴿٢٦﴾ وَهُوَ الَّذِي يَبْدَؤُا الْخَلْقَ ثُمَّ يُعِيدُهُ وَهُوَ اَهْوَنُ عَلَيْهِۜ وَلَهُ الْمَثَلُ الْاَعْلٰى فِي السَّمٰوَاتِ وَالْاَرْضِۚ وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ ﴿٢٧﴾ ضَرَبَ لَكُمْ مَثَلًا مِنْ اَنْفُسِكُمْۜ هَلْ لَكُمْ مِنْ مَا مَلَكَتْ اَيْمَانُكُمْ مِنْ شُرَكَٓاءَ فِي مَا رَزَقْنَاكُمْ فَاَنْتُمْ فِيهِ سَوَٓاءٌ تَخَافُونَهُمْ كَخِيفَتِكُمْ اَنْفُسَكُمْۜ كَذٰلِكَ نُفَصِّلُ الْاٰيَاتِ لِقَوْمٍ يَعْقِلُونَ ﴿٢٨﴾

---

**26) (وَلَهُ مَنْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ) - Göylərdə və yerdə olan hər bir məxluq Allah-Təalanın kamil qüdrətinə tabe olub onun itaətindən çıxa bilməz. (كُلٌّ لَهُ قَانِتُونَ) Ya iradə ilə, ya da məcburiyyətdən bütün məxluqat ancaq Allah-Təalanın hökm və iradəsinə itaət edib onun hakimiyyətindən çıxa bilməz.**

**27) (وَهُوَ الَّذِي يَبْدَؤُا الْخَلْقَ ثُمَّ يُعِيدُهُ) - Öz kamil qüdrəti ilə əvvəlcə bəşəriyyəti yaradıb öləndən sonra yenidən geri qaytarıb həyat verən Allah-Təaladır. (وَهُوَ اَهْوَنُ عَلَيْهِ) Siz insan nəslinin ağıl və məntiqinin şərtlərinə görə, Allah-Təala üçün bəşəriyyəti yenidən həyata gətirmək ilk yaratmaqdan daha asandır. Bəs nəyə görə qiyamət günündə yenidən dirilməyi inkar edirsiniz? (وَلَهُ الْمَثَلُ الْاَعْلٰى فِي السَّمٰوَاتِ وَالْاَرْضِ) - Göylərdə, yerdə dəlil və sübutlar, dil ilə zikr edilən uca vəsflər Allah-Təalaya məxsusdur. Hər bir şeyi yaratmağa və o, yox olandan sonra yenidən həyata gətirməyə Allah-Təala qadirdir. (وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ) Allah-Təala hər bir şeyə qalibdir, hər bir işi elm və hikmətlə edəndir.**

**28) (ضَرَبَ لَكُمْ مَثَلًا مِنْ اَنْفُسِكُمْ) - Allah-Təala siz insan nəslindən ötrü öz nəfsinizdən bir misal çəkir. O misala fikir verib diqqət edin. (هَلْ لَكُمْ مِنْ مَا مَلَكَتْ اَيْمَانُكُمْ مِنْ شُرَكَٓاءَ فِي مَا رَزَقْنَاكُمْ فَاَنْتُمْ فِيهِ سَوَٓاءٌ)** - (O misal budur:) **Siz razı olarsınız ki, malik olduğunuz qul və kənizlər sizə ruzi verdiyimiz dünya malında sizə şərik olub sizinlə birlikdə mallardan istifadə etsinlər? Necə ki, siz özünüz o maldan istifadə edirsiniz, onlar da sizin kimi istifadə etsinlər? Əlbəttə, bu mətləbə razı olan deyilsiniz. (تَخَافُونَهُمْ كَخِيفَتِكُمْ اَنْفُسَكُمْ)- Bəlkə, o qul və kənizlərin sizin malınıza şərik olub sizin kimi istifadə etmələrindən qorxub onların şərikliyinə razı olmursunuz. Necə ki siz azad olan şəxslər bir-birinizlə şərik olmaqdan qorxursuz ki, birdən o şərik malı sizin əlinizdən alıb müstəqil olsun. Bəlkə, siz istəyirsiniz ki, o şərikdən malı alıb hamısına sahib olasınız. Şərikliyə razı olmursuz. İndi ki qul və kənizlərin sizinlə belə şərikliyinə razı olmursunuz, bəs aləmlərin Rəbbi və bütün mövcudatın yaradıcısı olan Allah-Təalaya aciz olan məxluqu və hətta maddəni şərik etməyə necə razı olursunuz? (كَذٰلِكَ نُفَصِّلُ الْاٰيَاتِ لِقَوْمٍ يَعْقِلُونَ) - Necə ki, bəhs edildi, qüdrət və tövhidimizə dəlil olan ayələri ağılla rəftar edən camaatdan ötrü izah edib açıqlayırıq ki, bəlkə,* şirki tərk edib bir olan Allaha inanalar.**

بَلِ اتَّبَعَ الَّذِينَ ظَلَمُوٓا اَهْوَٓاءَهُمْ بِغَيْرِ عِلْمٍۚ فَمَنْ يَهْدِي مَنْ اَضَلَّ اللّٰهُۜ وَمَا لَهُمْ مِنْ نَاصِرِينَ ﴿٢٩﴾
فَاَقِمْ وَجْهَكَ لِلدِّينِ حَنِيفًاۜ فِطْرَتَ اللّٰهِ الَّتِي فَطَرَ النَّاسَ عَلَيْهَاۜ لَا تَبْدِيلَ لِخَلْقِ اللّٰهِ

---

*(*Qeyd: "İlahi, bütün müsəlmanlar özlərini islam dininə inanan hesab edib müvəhhid (tövhidə inanan) sayırlar. Amma peyğəmbərlərdən başlamış maddə və daş-torpağı da sənə şərik sayırlar. Ehtiyac anında hər bir aciz məxluqata və cansız maddəyə yönəlib bütpərəstlər bütlərə sitayiş edən kimi onlara təzim və hörmət edib ehtiyaclarını xahiş edib onlardan istəyirlər. Bundan böyük bütpərəstlik olarmı? Bu mətləb bu zamanda islam ümməti arasında geniş yayılıb özlərinə maddədən məbud (ibadət edilən) düzəldib onlara müqəddəs məkan adı verirlər, bəzi məqamlarda bir parça daş üstündə bir bina tikib xalq dəstə-dəstə ora gedib bütpərəstlik şüarını dirildib o əməli Allah-Təalaya yaxınlaşma səbəbi saydılar. Necə ki Məkkə əhli olan bütpərəstlər bütlərə sitayiş edib deyirdilər ki, bunlara bizi Allah-Təalaya yaxınlaşdırmaq üçün sitayiş edirik. Allah-Təala onlara kafir və müşrik deyib qanlarını halal buyurdu. Ey islam ümməti, Allah-Təalanın öz nəfsinizdəki əzəmət və cəlalına bir göz açıb fikir verin, şübhəsiz ki, cismləri Allahın məxluqu sayıb onlara yaxınlaşmağı və ziyarəti Allah-Təalaya yaxın saymayıb müşriklər qatarından özünüzü qurtarın. Bu sözlərin mahiyyətinə və həqiqətinə dürüst fikir verib mənim arzumu dərk edənlərə dua edirəm. Elm sahibi olanlardan başqası onu dərk edə bilməz).*

**29) (بَلِ اتَّبَعَ الَّذِينَ ظَلَمُوٓا اَهْوَٓاءَهُمْ بِغَيْرِ عِلْمٍۚ) - Müşrikləri zorla və məcburən Allah-Təalaya şirk qoşmağa məcbur edən yox idi. Bəlkə, zalım müşriklər cahilcəsinə öz nəfslərinə tabe olub Allah-Təalaya şirk qoşurdular. (فَمَنْ يَهْدِي مَنْ اَضَلَّ اللّٰهُ) Allah-Təala hər kimi ki küfr və şirki səbəbi ilə zəlil etsə, kim onu haqq tərəfinə hidayət etdirər? (وَمَا لَهُمْ مِنْ نَاصِرِينَ) - Və zalımlardan ötrü heç bir kömək edən tapılmayıb nicat tapmayacaqlar.**

**30) (فَاَقِمْ وَجْهَكَ لِلدِّينِ حَنِيفًاۜ) -** (Ey Məhəmməd)**, islam dinində sabit olmaqdan ötrü özünü möhkəm edib digər dinlərdən islam dininə tərəf meyil edib başqa heç bir dinə maraq göstərməyib islam dinində sabit və bərqərar ol. (فِطْرَتَ اللّٰهِ الَّتِي فَطَرَ النَّاسَ عَلَيْهَاۜ) -** (Ey Məhəmməd)**, sən özün və sənə tabe olanlar Allah-Təalanın o yaradılışı ki, xalqı onunla yaradıbdır, ondan vacib və möhkəm yapışın. Zillətə salan şeytanların vəsvəsəsinə tabe olmayın.** (Allah-Təala insan nəslini bütünlüklə tövhid üzrə yaradıb, onların ağlında Allah-Təalaya iman elmi yerləşdirib tövhidə inanan olmağı vaqe edibdir). **Əgər insan nəfsinin istəklərinə tabe olmaqla mübarək ağlını zülmət və cəhalət pərdəsi ilə örtməsə, hər halda müvəhhid olar. Hər bir şeyin həqiqətinə çatıb gücü yetdiyi qədər hidayət tapacaqdır. (لَا تَبْدِيلَ لِخَلْقِ اللّٰهِ) - Nəfsin istəklərinə tabe olub Allah-Təalanın yaratdığını** (tövhidini) **dəyişdirmək heç bir vaxt layiqli iş deyildir.**

ذٰلِكَ الدّ۪ينُ الْقَيِّمُۙ وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَۙ ﴿٣٠﴾ مُن۪يب۪ينَ اِلَيْهِ وَاتَّقُوهُ وَاَق۪يمُوا الصَّلٰوةَ
وَلَا تَكُونُوا مِنَ الْمُشْرِك۪ينَۙ ﴿٣١﴾ مِنَ الَّذ۪ينَ فَرَّقُوا د۪ينَهُمْ وَكَانُوا شِيَعًاۜ كُلُّ حِزْبٍ بِمَا لَدَيْهِمْ
فَرِحُونَ﴿٣٢﴾

---

(ذٰلِكَ الدّ۪ينُ الْقَيِّمُ) - **Bu islam dini** (müvəhhid olmaq) **möhkəm və haqq olan dindir.** (وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ) **- Lakin insanların əksəriyyəti nəfsani arzulara tabe olub, cəhalətdə qaldıqları üçün islam dininin haqq olmağından agah deyildir.**

**31)** (مُن۪يب۪ينَ اِلَيْهِ ) - (Ey Məhəmməd)**, sən özün, sənə tabe olanlar tövbə edib itaət və ibadətlə Allah-Təala tərəfinə dönün.**

(وَاتَّقُوهُ وَاَق۪يمُوا الصَّلٰوةَ وَلَا تَكُونُوا مِنَ الْمُشْرِك۪ينَ) **- Allah-Təaladan qorxub, namaz qılıb, müşriklərdən olmayın.**

**32)** (مِنَ الَّذ۪ينَ فَرَّقُوا د۪ينَهُمْ ) **- Olmayın o şəxslərdən ki, nəfslərinin istəklərinə tabe olub dinlərini ayırıb hər tayfa özündən ötrü bir din və ayin qərar veriblər.** (Necə ki bizim bu dövrdə islam ümməti bu dərdə mübtəla olub). (وَكَانُوا شِيَعًاۜ) **- Neçə qrup olub hər qrup özündən ötrü bir imam rəhbər seçibdir.** (كُلُّ حِزْبٍ بِمَا لَدَيْهِمْ فَرِحُونَ) **- Bununla belə hər bir dəstə və hər bir qrup özlərinin seçdiyi din və məzhəblə şad olub özgə qrupların din və məzhəbinə* batil deyib onları zındıq sayırlar.**

*(*Qeyd:* *"Bu mübarək ayənin məzmunu eynilə bizim dövrümüzə uyğundur. İslam ümməti neçə qrupa bölünüb, bir-birini təkfir etdikləri üçün digər millətlərdən baxan şəxslər bu qruplardan hansının islam dininə inanan olmasını seçməkdə aciz qalırlar. Hər tayfa özünə bir imam, bir rəhbər seçib özlərinə məxsus adlar qoyub özündən başqasını mütləq kafir və cəhənnəm oduna layiq sayır. Əşəriyyə, mötəzilə, zeydiyyə, keysaniyyə, fəthiyyə, vaqifiyyə, cəbriyyə, qədəriyyə, bunlardan başqa adlarda olanlar, əgər hamısından bəhs etsəm 70 min "Məsnəvi" səhifəsi lazımdır. Qurani-Şərifi tərk edib nəfsin istəklərinə tabe olmaqdan bu ixtilaflar meydana gəlibdir. Bütün islam ümməti, gərək, Qurani-Şərifi özünə imam və rəhbər seçsin. Əgər Qurani-Şərifi özlərinə imam seçsəydilər, bugünkü fəlakət gününə düçar olmazdılar. Digər millətlərdən məlumatsız olan şəxslər islam ümməti arasında yayılan cəhalət və vəhşəti, əxlaqsızlığı Qurani-Şərifə isnad edib: "Quran tərbiyəyə və mədəniləşməyə maneədir," -deyib Qurana tənə edirlər. Bu mətləb son dərəcədə səhv və xətadır. Bəlkə, islam ümməti arasında zühura gələn vəhşət və əxlaqsızlıq Qurani-Şərifi tərk edib nəfsin istəyi ilə özləri üçün məzhəb və təriqətlər yaratmaqdan meydana gəlibdir. İslamın ilk dövrlərində çətin təbiətli ərəb camaatının islam dini ilə şərəfləndikdən sonra Qurani-Şərifə yapışıb əxlaqlarının gözəlləşməsi və mədəniləşmələri heç bir insaflı və düşünən şəxslərdən gizli deyil. Bu yer*

وَاِذَا مَسَّ النَّاسَ ضُرٌّ دَعَوْا رَبَّهُمْ مُنِيبِينَ اِلَيْهِ ثُمَّ اِذَٓا اَذَاقَهُمْ مِنْهُ رَحْمَةً اِذَا فَرِيقٌ مِنْهُمْ بِرَبِّهِمْ يُشْرِكُونَ
﴿٣٣﴾ لِيَكْفُرُوا بِمَٓا اٰتَيْنَاهُمْ فَتَمَتَّعُوا فَسَوْفَ تَعْلَمُونَ ﴿٣٤﴾ اَمْ اَنْزَلْنَا عَلَيْهِمْ سُلْطَانًا فَهُوَ يَتَكَلَّمُ بِمَا
كَانُوا بِهٖ يُشْرِكُونَ ﴿٣٥﴾ وَاِذَٓا اَذَقْنَا النَّاسَ رَحْمَةً فَرِحُوا بِهَا وَاِنْ تُصِبْهُمْ سَيِّئَةٌ بِمَا قَدَّمَتْ اَيْدٖيهِمْ
اِذَا هُمْ يَقْنَطُونَ ﴿٣٦﴾

---

*kürəsinin son anına kimi Qurani-Şərifin insan nəslindən ötrü tərbiyə və mədəniyyət aləminə daxil olmaları üçün böyük dəlil və hidayətverici olması şübhəsizdir. Bu zamanda islam ümmətində bütünlüklə maarif və mədəniyyətə hiss edilən meyil və rəğbət ancaq Qurani-Şərifə yönəlmələri səbəbi ilə zühura gəlibdir. Əlbəttə, bu mətləbi insaf əhli inkar etməz. Nə qədər ki islam ümməti öz içindəki savaşı bitirib Qurani-Şərifdə birləşməyiblər, tərbiyə və mədəniyyət aləminə daxil olmaları imkansız görünür).*

**33) (وَاِذَا مَسَّ النَّاسَ ضُرٌّ دَعَوْا رَبَّهُمْ مُنِيبِينَ اِلَيْهِ) - O zaman ki insanın özünə və ya malına, ya da övladlarına bir zərər və müsibət yetişdi, o vaxt öz rəbləri Allah-Təala tərəfinə yönəlib o zərər və müsibəti yox etməkdən ötrü Allah-Təalaya dua edərlər. (ثُمَّ اِذَٓا اَذَاقَهُمْ مِنْهُ رَحْمَةً اِذَا فَرِيقٌ مِنْهُمْ بِرَبِّهِمْ يُشْرِكُونَ) - Allah-Təalaya dua edəndən sonra nə vaxt ki, Allah-Təala öz rəhmətindən onlara dadızdırıb o zərər və müsibəti onlardan yox etdi, dərhal görərsən ki,** (ey Məhəmməd), **Allah-Təalanın lütf və mərhəməti ilə yox olan zərəri bir qrup Allah-Təalanın vasitə etdiyi şeyə isnad verib o vasitəni öz rəbləri Allah-Təalaya şərik sayıb müşrik olarlar.**

**34) (لِيَكْفُرُوا بِمَٓا اٰتَيْنَاهُمْ) - Görəsən, biz onlara nemət verib zərər və müsibəti onlardan yox etdik ki, bizim verdiyimiz nemətlərə kafir olub bizə şərik qoşsunlar? Bundan ötrü onlara nemət verməmişdik. Şükür etmələri üçün onlara nemət verdik, amma onlar kafir oldular. (فَتَمَتَّعُوا فَسَوْفَ تَعْلَمُونَ) - Ey nemətə kafir olanlar, sizin nemətə küfr edib müşrik olmağınızın bizə heç bir zərəri yoxdur. O nemətlərdən bir müddət ləzzət alın. O ləzzət almağın təqsirinə görə, bizim əzabımıza düçar olmağınıza az qalıb.**

**35) (اَمْ اَنْزَلْنَا عَلَيْهِمْ سُلْطَانًا فَهُوَ يَتَكَلَّمُ بِمَا كَانُوا بِهٖ يُشْرِكُونَ) - Ya da ki görəsən, bir dəlil və sübut müşriklərə göndərmişdik ki, o dəlil müşriklərin bizə şərik qoşmalarının doğruluğuna işarə etsin? Belə bir dəlil ki, bizim tərəfimizdən yoxdur, bəs bizə necə şərik qoşurlar?**

**36) (وَاِذَٓا اَذَقْنَا النَّاسَ رَحْمَةً فَرِحُوا بِهَا) -** (Ey Məhəmməd), **o zaman ki insan nəslinə bir rəhmət** (ruzi çoxluğu, ya da ki, bədən sağlamlığı) **dadızdırdıq, o rəhmətə** (nemətə) **şad olarlar. (وَاِنْ تُصِبْهُمْ سَيِّئَةٌ بِمَا قَدَّمَتْ اَيْدٖيهِمْ اِذَا هُمْ يَقْنَطُونَ) - Amma əgər öz əllərilə yerinə yetirilən xəbis əməlləri səbəbi ilə bir bəla və müsibət onlara yetişə, o Allah-Təalanın rəhmət və nemətinə şükür edib, bəla və müsibətə səbr edib, Allah-Təalanın rəhmətinə ümid etsinlər.**

اَوَلَمْ يَرَوْا اَنَّ اللّٰهَ يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ وَيَقْدِرُۜ اِنَّ فٖي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يُؤْمِنُونَ ﴿٣٧﴾ فَاٰتِ ذَا الْقُرْبٰى حَقَّهُ وَالْمِسْكٖينَ وَابْنَ السَّبٖيلِۜ ذٰلِكَ خَيْرٌ لِلَّذٖينَ يُرٖيدُونَ وَجْهَ اللّٰهِۘ وَاُو۬لٰٓئِكَ هُمُ الْمُفْلِحُونَ ﴿٣٨﴾ وَمَٓا اٰتَيْتُمْ مِنْ رِبًا لِيَرْبُوَا۬ فٖٓي اَمْوَالِ النَّاسِ فَلَا يَرْبُوا عِنْدَ اللّٰهِۚ وَمَٓا اٰتَيْتُمْ مِنْ زَكٰوةٍ تُرٖيدُونَ وَجْهَ اللّٰهِ فَاُو۬لٰٓئِكَ هُمُ الْمُضْعِفُونَ ﴿٣٩﴾ اَللّٰهُ الَّذٖي خَلَقَكُمْ ثُمَّ رَزَقَكُمْ ثُمَّ يُمٖيتُكُمْ ثُمَّ يُحْيٖيكُمْۜ

---

**37) (اَوَلَمْ يَرَوْا اَنَّ اللّٰهَ يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ وَيَقْدِرُۜ)** - (Ey Məhəmməd), **bəs bu xalq baxıb görmür ki, hər bir şəxsdən ötrü Allah-Təala özü istəsə ruzini bol edib firavan edər və hər bir şəxsə istəsə, dar edər, bəs niyə məyus olub Allah-Təalanın rəhmətindən ümidvar olmurlar?**

**(اِنَّ فٖي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يُؤْمِنُونَ) - Həqiqətən, Allah-Təalanın ruzini bəzilərinə bol, bəzilərinə dar verməsində yeganə olan Allah-Təalaya iman gətirən camaatdan ötrü onun tövhid və qüdrətinə dəlil, sübutlar vardır.**

**38) (فَاٰتِ ذَا الْقُرْبٰى حَقَّهُ وَالْمِسْكٖينَ وَابْنَ السَّبٖيلِۜ)** - (Ey Məhəmməd), **sənə soyda* yaxın olan şəxslərin, yoxsulların və yol əsnasında pulları qurtaran müsafirlərin haqqını öz malından ödə, (ذٰلِكَ خَيْرٌ لِلَّذٖينَ يُرٖيدُونَ وَجْهَ اللّٰهِ) - bəhs olunan şəxslərin haqlarını ödəmək o şəxslərdən ötrü yaxşıdır ki, Allah-Təalaya yaxınlaşmağı arzu edib məqsədləri onun məmnunluğunu əldə etməkdir. (وَاُو۬لٰٓئِكَ هُمُ الْمُفْلِحُونَ) - Və əlbəttə onlardır nicat tapanlar.** (Sıradaki mübarək ayə yoxsullara borc verib onlardan faiz alıb yeyənlərin haqqında gəlib).

*(*__Qeyd:__ "Mübarək ayə buna dəlildir ki, varlı şəxslərin malında bəhs edilən şəxslərin haqları vardır. Allah-Təala o haqqı qərar verib ki, islam ümmətində gəda, yoxsul, dilənçi, bikef olmasın. İlahi, necə olub ki, sənin mübarək əmrlərinə əməl olunmayıb, islam ümmətinin övladları bu qədər zillətə düçar olublar? Hanı keçən zamanlarda olan xeyir sahibləri ki, yoxsullardan ötrü tikdirdikləri qocalar evləri və xəstəxanaların izləri bəzi islam ölkələrində hələ də qalıb?)*

**39) (وَمَٓا اٰتَيْتُمْ مِنْ رِبًا لِيَرْبُوَا۬ فٖٓي اَمْوَالِ النَّاسِ فَلَا يَرْبُوا عِنْدَ اللّٰهِ) - Hər bir mal ki, onu faizlə yeməyi qəsd edib xalqa borc verirsiniz, belə ki, xalqın malı hesabına artsın, o mal Allah-Təala yanında haram olub artımsızdır (وَمَٓا اٰتَيْتُمْ مِنْ زَكٰوةٍ تُرٖيدُونَ وَجْهَ اللّٰهِ فَاُو۬لٰٓئِكَ هُمُ الْمُضْعِفُونَ) - Amma hər bir sədəqə ki, Allah-Təalanın məmnunluğu üçün haqqı olana verəsiz,** (Ey Məhəmməd), **mükafat və savablarını sədəqə verərək artıranlar bu şəxslərdir.**

**40) (اَللّٰهُ الَّذٖي خَلَقَكُمْ ثُمَّ رَزَقَكُمْ ثُمَّ يُمٖيتُكُمْ ثُمَّ يُحْيٖيكُمْ) - Əvvəlcə sizi yoxdan yaradıb, ondan sonra sizə ruzi verib, ondan sonra sizi öldürüb, ondan sonra sizi diriləndən Allah-Təaladır. Bu feillər Allah-Təalaya məxsusdur. Allah-Təaladan başqa, heç bir nəfər bunlara qadir deyil.**

هَلْ مِنْ شُرَكَآئِكُمْ مَنْ يَفْعَلُ مِنْ ذٰلِكُمْ مِنْ شَيْءٍۜ سُبْحَانَهُ وَتَعَالٰى عَمَّا يُشْرِكُونَ ﴿٤٠﴾ ظَهَرَ الْفَسَادُ
فِي الْبَرِّ وَالْبَحْرِ بِمَا كَسَبَتْ اَيْدِي النَّاسِ لِيُذِيقَهُمْ بَعْضَ الَّذِي عَمِلُوا لَعَلَّهُمْ يَرْجِعُونَ ﴿٤١﴾ قُلْ
سِيرُوا فِي الْاَرْضِ فَانْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الَّذِينَ مِنْ قَبْلُۜ كَانَ اَكْثَرُهُمْ مُشْرِكِينَ ﴿٤٢﴾ فَاَقِمْ
وَجْهَكَ لِلدِّينِ الْقَيِّمِ مِنْ قَبْلِ اَنْ يَاْتِيَ يَوْمٌ لَا مَرَدَّ لَهُ مِنَ اللّٰهِ

---

(هَلْ مِنْ شُرَكَآئِكُمْ مَنْ يَفْعَلُ مِنْ ذٰلِكُمْ مِنْ شَيْءٍۜ) - **Bəs Allah-Təalaya şirk qoşduqlarınızdan elə şəxs var ki, bu bəhs edilənlərdən bir şey əmələ gətirsin? Əlbəttə, yoxdur. Bəs nəyə görə belə aciz şeyləri Allah-Təalaya şərik sayırsınız?** (سُبْحَانَهُ وَتَعَالٰى عَمَّا يُشْرِكُونَ) - **Allah-Təala pak, qüsursuz və ucadır o şeylərdən ki, ona şərik sayırsınız.**

**41)** (ظَهَرَ الْفَسَادُ فِي الْبَرِّ وَالْبَحْرِ بِمَا كَسَبَتْ اَيْدِي النَّاسِ) - (Ey Məhəmməd), **xalq Allah-Təalaya asi olub əlləri ilə etdikləri əməlləri** (günah) **səbəbi ilə səhrada və dənizdə fəsad yarandı.** (Amma səhrada yağışın az yağıb əkinlərin məhsul verməməsi, qəhətlik və qiymətin yuxarı olması, dənizlərdə gəmilərin qərq olması, nəticədə ticarətdən mənfəət əldə etməmək, bunlar hamısı hər bir zamanda insan nəslinin öz əməllərinin səbəbidir.) (لِيُذِيقَهُمْ بَعْضَ الَّذِي عَمِلُوا لَعَلَّهُمْ يَرْجِعُونَ) **- Allah-Təala insan nəslinin öz əməlləri səbəbi ilə onların məişətlərinə nöqsan yetirər, belə ki, bəzi əməllərinin təqsirini, əzabını bu dünyada onlara dadızdırsın. Bəlkə, çirkin əməllərdən və Allah-Təalaya asi olmaqdan qayıdıb, tövbə edib, Allah-Təalanın yoluna qayıtsınlar.**

**42)** (قُلْ سِيرُوا فِي الْاَرْضِ) - (Ey Məhəmməd), **müşriklərə və Allah-Təalaya asi olanlara de ki, yer üzündə bir seyr edib Allah-Təalaya asi olan camaatların diyarlarını gəzin.** (فَانْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الَّذِينَ مِنْ قَبْلُۜ كَانَ اَكْثَرُهُمْ مُشْرِكِينَ) **- Gəzəndən sonra baxıb ibrət götürün onlar sizdən əvvəl Allah-Təalaya asi olmuşdular, necə Allah-Təala onları öz əməlləri səbəbi ilə həlak etdi və bu həlak etmək təkcə Allah-Təalaya şirk qoşduqları üçün deyildi. Bəlkə, şirkdən artıq və ya əskik olan günahları səbəbi ilə onları həlak etdi. Çünki onların əksəriyyəti müşrik, az bir qismi qeyri-müşrik idi. Əgər onların həlak olması şirk səbəbindən olsaydı, gərək, qeyri-müşrikləri həlak etməyərdi.**

**43)** (فَاَقِمْ وَجْهَكَ لِلدِّينِ الْقَيِّمِ مِنْ قَبْلِ اَنْ يَاْتِيَ يَوْمٌ لَا مَرَدَّ لَهُ مِنَ اللّٰهِ) - (Ey Məhəmməd), **bir gün ki** (qiyamət günü) **o günün şiddət və əzabını heç bir nəfər qaytara bilməyəcəkdir. Belə bir gün gəlmədən əvvəl sən islam dininin istiqaməti üzrə sabit və davamlı ol. Çünki o gün islam dinində davamlı olub, müvəhhid olmaqdan başqa heç bir şey insana fayda verməz.** (يَوْمَئِذٍ يَصَّدَّعُونَ) **- Ogünkü gündə xalq bir-birindən** (kafir mömindən) **aralanıb hər şəxs öz əməlinin cəzasına çatar.**

مَنْ كَفَرَ فَعَلَيْهِ كُفْرُهُ ۚ وَمَنْ عَمِلَ صَالِحًا فَلِاَنْفُسِهِمْ يَمْهَدُونَ ۙ ﴿٤٤﴾ لِيَجْزِيَ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا
الصَّالِحَاتِ مِنْ فَضْلِهِ ۜ اِنَّهُ لَا يُحِبُّ الْكَافِرِينَ ﴿٤٥﴾ وَمِنْ اٰيَاتِهِ اَنْ يُرْسِلَ الرِّيَاحَ مُبَشِّرَاتٍ وَلِيُذِيقَكُمْ
مِنْ رَحْمَتِهِ وَلِتَجْرِيَ الْفُلْكُ بِاَمْرِهِ وَلِتَبْتَغُوا مِنْ فَضْلِهِ وَلَعَلَّكُمْ تَشْكُرُونَ ﴿٤٦﴾ وَلَقَدْ اَرْسَلْنَا مِنْ
قَبْلِكَ رُسُلًا اِلٰى قَوْمِهِمْ فَجَاۤؤُهُمْ بِالْبَيِّنَاتِ فَانْتَقَمْنَا مِنَ الَّذِينَ اَجْرَمُوا ۜ

---

**44) (مَنْ كَفَرَ فَعَلَيْهِ كُفْرُهُ) - Kim kafir olsa, onun küfrünün zərəri özünə aid olar. Heç bir digər şəxsə onun küfründən zərər gəlməz.**

**(وَمَنْ عَمِلَ صَالِحًا فَلِاَنْفُسِهِمْ يَمْهَدُونَ) - Amma kimin əməli xeyirli olsa, onlar özlərindən ötrü axirətdə rahat yatma məkanı düzəldib hazır edirlər.** (Necə ki hər bir şəxs dünyada rahat yatacağı yerini hər bir zərərli şeylərdən pak edər, xeyir əməl sahibləri də axirətdə özlərindən ötrü belə məqamları hazır edərlər).

**45) (لِيَجْزِيَ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ مِنْ فَضْلِهِ) - Xeyir əməl sahibləri axirətdə özlərindən ötrü rahatlıq məkanı hazır edərlər, belə ki, Allah-Təala da belə iman edib xeyir əməl edənlərə öz lütf və rəhmətindən qarşılıq versin. (اِنَّهُ لَا يُحِبُّ الْكَافِرِينَ) Həqiqətən, Allah-Təala kafirləri istəməyib, onlara heç bir xeyir verən deyildir.**

**46) (وَمِنْ اٰيَاتِهِ اَنْ يُرْسِلَ الرِّيَاحَ مُبَشِّرَاتٍ) - Allah-Təalanın öz bəndələrinə lütf və rəhmət etməyinə işarə edən ayə və əlamətlərindən biri də küləkləri öz rəhmətini** (yağış və qar ruzisi səbəblərini) **müjdələyərək göndərməsidir.** (Cənub, şimal, bir də səba küləyi Allah-Təalanın rəhmətinə səbəb olan küləklərdir, amma deyirlər ki, məğrib küləyi faydasız olub ilahi qəzəbə işarə edən küləkdir. Neçə xalqı Allah-Təala qərb küləyi ilə həlak edibdir). **(وَلِيُذِيقَكُمْ مِنْ رَحْمَتِهِ) - Bir də Allah-Təala küləkləri göndərir, belə ki, onlar buludları hərəkət etdirməklə Allah-Təala öz rəhmətindən** (yağış və qardan) **sizə dadızdırsın. (وَلِتَجْرِيَ الْفُلْكُ بِاَمْرِهِ وَلِتَبْتَغُوا مِنْ فَضْلِهِ) - Bir də o küləklər səbəbindən gəmilər dənizdə üzüb, o səbəbdən Allah-Təalanın lütf və rəhmətindən dənizdə ruzi əldə edəsiniz. (وَلَعَلَّكُمْ تَشْكُرُونَ) - Və əlbəttə gərək Allah-Təalanın nemətlərinə şükür edəsiniz.** (Əgər bu zamanda gəmilərin əksəriyyəti insanlığa əmanət edilən elm səbəbi ilə buxar gücü ilə dənizlərdə üzürlər, lakin hər halda onların küləklərə ehtiyacı vardır. Belə ki, öz məqsədlərinə müvafiq hərəkət edib gəmilərin qurtuluş sahilinə çatmasına mane olmasınlar. Çox olub ki, iri gəmilər küləklərin hərəkəti səbəbi ilə zədələnib dənizin dibində qalıb).

**47) (وَلَقَدْ اَرْسَلْنَا مِنْ قَبْلِكَ رُسُلًا اِلٰى قَوْمِهِمْ فَجَاۤؤُهُمْ بِالْبَيِّنَاتِ) -** (Ey Məhəmməd), **həqiqətən, səndən əvvəl bir neçə peyğəmbəri öz xalqlarına göndərdik ki, onları bizim tərəfimizə dəvət etsinlər. Peyğəmbərlər o xalqlara doğruluqlarını işarə edən aşkar dəlil və sübutları ilə gəldilər, lakin onlar o peyğəmbərlərə itaət etmədilər. Necə ki sənin xalqın sənə itaət etmədi. (فَانْتَقَمْنَا مِنَ الَّذِينَ اَجْرَمُوا) - O peyğəmbərləri təkzib edən kafirlərdən intiqam alıb, onları həlak edib möminləri onlardan xilas etdik.**

وَكَانَ حَقًّا عَلَيْنَا نَصْرُ الْمُؤْمِنِينَ ﴿٤٧﴾ اَللّٰهُ الَّذِي يُرْسِلُ الرِّيَاحَ فَتُثِيرُ سَحَابًا فَيَبْسُطُهُ فِي السَّمَآءِ
كَيْفَ يَشَآءُ وَيَجْعَلُهُ كِسَفًافَتَرَى الْوَدْقَ يَخْرُجُ مِنْ خِلَالِهِۚ فَاِذَآ اَصَابَ بِهِ مَنْ يَشَآءُ مِنْ عِبَادِهٖٓ اِذَا
هُمْ يَسْتَبْشِرُونَ ﴿٤٨﴾ وَاِنْ كَانُوا مِنْ قَبْلِ اَنْ يُنَزَّلَ عَلَيْهِمْ مِنْ قَبْلِهٖ لَمُبْلِسِينَ ﴿٤٩﴾فَانْظُرْ اِلٰى
اٰثَارِ رَحْمَتِ اللّٰهِ كَيْفَ يُحْيِي الْاَرْضَ بَعْدَ مَوْتِهَاۜ اِنَّ ذٰلِكَ لَمُحْيِي الْمَوْتٰىۚ وَهُوَ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ
﴿٥٠﴾وَلَئِنْ اَرْسَلْنَا رِيحًا فَرَاَوْهُ مُصْفَرًّا لَظَلُّوا مِنْ بَعْدِهٖ يَكْفُرُونَ ﴿٥١﴾

---

(وَكَانَ حَقًّا عَلَيْنَا نَصْرُ الْمُؤْمِنِينَ) - (Ey Məhəmməd), **möminlərə kömək olub onları zalımlardan xilas etmək bizə vacibdir. Gərək, hər bir halda möminlərə kömək edək, habelə sənə və sənə iman edən möminlərə də kömək olub müşrikləri həlak, ya da ki zəlil edib sizi xilas edib onlara qalib edəcəyəm.** (Allah-Təalanın bu kəlamı doğru olub Allahın Rəsulunu və möminləri Məkkə əhli olan Qüreyşə qalib edib onları zəlil etdi).

**48)** (اَللّٰهُ الَّذِي يُرْسِلُ الرِّيَاحَ فَتُثِيرُ سَحَابًا) **- Allah-Təala kamil qüdrəti ilə küləklər göndərir. O küləklər hərəkət edib bulud yaradıb o buludu yayarlar.**

(فَيَبْسُطُهُ فِي السَّمَآءِ كَيْفَ يَشَآءُ) **- Ondan sonra Allah-Təala o buludu göydə özü istəyən kimi yayıb açar. Gah onları bir-birinə birləşdirər,** (وَيَجْعَلُهُ كِسَفًا) **gah da onları parça-parça edər.** (فَتَرَى الْوَدْقَ يَخْرُجُ مِنْ خِلَالِهِۚ) **- Ey insan, görürsən ki, yağış o buludun arasından çıxıb yer üzünə enər.** (Bir halda ki, yox yerdən Allah-Təala buludu yaradıb yağış endirsin, yenə Allah-Təalanın qüdrətini inkar edirsiniz). (فَاِذَآ اَصَابَ بِهِ مَنْ يَشَآءُ مِنْ عِبَادِهٖٓ اِذَا هُمْ يَسْتَبْشِرُونَ) **- O zaman ki yağış Allah-Təalanın istədiyi bəndələrinə yağıb əkinləri məhsul verə, əlbəttə, onlar o yağışa görə şadlıq edərlər.**

**49)** (وَاِنْ كَانُوا مِنْ قَبْلِ اَنْ يُنَزَّلَ عَلَيْهِمْ مِنْ قَبْلِهٖ لَمُبْلِسِينَ) **- Əgər yağış onlara gəlmədən əvvəl yağışın gəlməyindən ümidsiz və məyus idilərsə, yağış gəlincə şadlıq edərlər.**

**50)** (فَانْظُرْ اِلٰى اٰثَارِ رَحْمَتِ اللّٰهِ كَيْفَ يُحْيِي الْاَرْضَ بَعْدَ مَوْتِهَاۜ) **- Bax gör** (ey Məhəmməd), **Allah-Təalanın rəhmətinin** (yağışın) **əsərlərinə ki, yağış gələndən sonra yerə necə həyat verib onları gözəlləşdirir və ona baxanı şad edir.** (اِنَّ ذٰلِكَ لَمُحْيِي الْمَوْتٰى) **- Yenidən ölülərə həyat verən belə qüdrət sahibi Allah-Təaladır. Necə ki əvvəlcə yeri dirildib ona yeni bir həyat verir, habelə siz insan nəslini də qiyamət günündə dirildib yeni həyat verəcəkdir. Bəs niyə qiyaməti inkar edirsiniz?** (وَهُوَ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ) **- Və madam ki Allah-Təala hər bir şeyə qadirdir, o cümlədən sizə yenidən həyat verməyə də qadirdir.**

**51)** (وَلَئِنْ اَرْسَلْنَا رِيحًا فَرَاَوْهُ مُصْفَرًّا) **- Əgər biz külək göndərib onların əkinlərini qurudub yandıraq, o vaxt o əkinləri saralmış görərlər.**

(لَظَلُّوا مِنْ بَعْدِهٖ يَكْفُرُونَ) **- Onların əkinləri saralandan sonra yenidən Allah-Təalanın nemətlərinə kafir olarlar, halbuki gərək bəla vaxtında səbr edib nemətə şükr edəydilər. Nə nemətə şükr edirlər, nə də bəlaya səbir edirlər.**

فَاِنَّكَ لَا تُسْمِعُ الْمَوْتٰى وَلَا تُسْمِعُ الصُّمَّ الدُّعَٓاءَ اِذَا وَلَّوْا مُدْبِرِينَ ﴿٥٢﴾ وَمَٓا اَنْتَ بِهَادِ الْعُمْيِ عَنْ
ضَلَالَتِهِمْؕ اِنْ تُسْمِعُ اِلَّا مَنْ يُؤْمِنُ بِاٰيَاتِنَا فَهُمْ مُسْلِمُونَ ﴿٥٣﴾ اَللّٰهُ الَّذِي خَلَقَكُمْ مِنْ ضَعْفٍ ثُمَّ
جَعَلَ مِنْ بَعْدِ ضَعْفٍ قُوَّةً ثُمَّ جَعَلَ مِنْ بَعْدِ قُوَّةٍ ضَعْفًا وَشَيْبَةًۜ يَخْلُقُ مَا يَشَٓاءُۚ وَهُوَ الْعَلِيمُ الْقَدِيرُ
﴿٥٤﴾ وَيَوْمَ تَقُومُ السَّاعَةُ يُقْسِمُ الْمُجْرِمُونَۙ مَا لَبِثُوا غَيْرَ سَاعَةٍۜ كَذٰلِكَ كَانُوا يُؤْفَكُونَ ﴿٥٥﴾

---

**52) (فَاِنَّكَ لَا تُسْمِعُ الْمَوْتٰى)** - (Ey Məhəmməd), **bu müşriklər ölülər kimidir, həqiqətən sən elə bir söz eşitdirməyə qadir deyilsən. Əbəs yerə zəhmət çəkib müşriklərə daha öyüd-nəsihət etmə. Onlara söz təsir etməyib, imana gələn deyilər. Bu vaxta kimi nəsihət etməyin kifayət edər. (وَلَا تُسْمِعُ الصُّمَّ الدُّعَٓاءَ اِذَا وَلَّوْا مُدْبِرِينَ) Qulaqları haqq işığından kar olan şəxslər nə zaman ki sənə arxa çevirib qaçdılar, onlara da söz eşitdirməyə qadir deyilsən. Qoy onlar öz yerlərində qalsınlar. Allah-Təala onları öz cəzasına çatdıracaqdır. İnkarçılar ölü və kar kimidirlər.**

**53) (وَمَٓا اَنْتَ بِهَادِ الْعُمْيِ عَنْ ضَلَالَتِهِمْ)** - (Ey Məhəmməd), **haqqı dərk etməyə kor olub inad və zillətdə qalan şəxsləri zillətlərindən hidayətə çıxarıb haqq yoluna vasil edə bilməzsən. Məgər ki Allah-Təala özü onları zorla imana daxil etsin. (اِنْ تُسْمِعُ اِلَّا مَنْ يُؤْمِنُ بِاٰيَاتِنَا فَهُمْ مُسْلِمُونَ)** - (Ey Məhəmməd), **sən ağıl nuru ilə bizim ayələrimizə iman edib, bizim əmr və qadağalarımıza itaət edən şəxslərdən başqasına haqq sözü eşitdirə bilməzsən.** (Cəhalət və inad məqamında qalan şəxslərə heç bir haqq şeyi öyrətmək olmaz).

**54) (اَللّٰهُ الَّذِي خَلَقَكُمْ مِنْ ضَعْفٍ) - Allah-Təala siz insan nəslini əvvəlcə** (uşaqlıq halında) **aciz və zəif yaradıbdır. (ثُمَّ جَعَلَ مِنْ بَعْدِ ضَعْفٍ قُوَّةً) - Ondan sonra sizi inkişaf etdirib o zəiflik və acizlikdən sonra sizə qüvvət bəxş edib sizi yetkinlik və cavanlıq həddinə çatdırıb bütün gücünüzü mükəmməlləşdirdi. (ثُمَّ جَعَلَ مِنْ بَعْدِ قُوَّةٍ ضَعْفًا وَشَيْبَةً) - Gücünüz mükəmməlləşəndən sonra əvvəlki uşaqlıq halı kimi zəiflik və qocalığı sizə düçar etdi. (يَخْلُقُ مَا يَشَٓاءُ) - Hər bir şeyi ki, Allah-Təala istəyə** (cavanlıq, qocalıq, zəif, qüvvət) **yaradar. Heç bir şey Allah-Təalanın qüdrətindən xaric ola bilməz. (وَهُوَ الْعَلِيمُ الْقَدِيرُ) - Allah-Təala hər bir şeyə alim və qadirdir.** (İnsan nəslinin bir sifətdən digər bir sifətə, bir haldan digər bir hala keçib dəyişməsi Allah-Təalanın elm və qüdrətinə açıq bir dəlil, ədalətli bir şahiddir).

**55) (وَيَوْمَ تَقُومُ السَّاعَةُ) - O zaman ki qiyamət günü vaqe olar. (يُقْسِمُ الْمُجْرِمُونَ مَا لَبِثُوا غَيْرَ سَاعَةٍ) - O gündə müşrik və asilər and içib bir-birilərinə deyərlər: "Dünyada bir saatdan artıq qalıb yaşamayıblar ki, xeyir iş görüb Allah-Təalaya itaət etsinlər. (كَذٰلِكَ كَانُوا يُؤْفَكُونَ) Axirətdə yalan deyəcəkləri kimi dünyada da nəfsin istəklərinə tabe olmaları onları haqdan döndərib qiyaməti inkar etdilər.**

وَقَالَ الَّذٖينَ اُوتُوا الْعِلْمَ وَالْاٖيمَانَ لَقَدْ لَبِثْتُمْ فٖي كِتَابِ اللّٰهِ اِلٰى يَوْمِ الْبَعْثِۘ فَهٰذَا يَوْمُ الْبَعْثِ وَلٰكِنَّكُمْ
كُنْتُمْ لَا تَعْلَمُونَ ﴿٥٦﴾ فَيَوْمَئِذٍ لَا يَنْفَعُ الَّذٖينَ ظَلَمُوا مَعْذِرَتُهُمْ وَلَا هُمْ يُسْتَعْتَبُونَ ﴿٥٧﴾ وَلَقَدْ
ضَرَبْنَا لِلنَّاسِ فٖي هٰذَا الْقُرْاٰنِ مِنْ كُلِّ مَثَلٍۜ وَلَئِنْ جِئْتَهُمْ بِاٰيَةٍ لَيَقُولَنَّ الَّذٖينَ كَفَرُوٓا اِنْ اَنْتُمْ اِلَّا
مُبْطِلُونَ﴿٥٨﴾ كَذٰلِكَ يَطْبَعُ اللّٰهُ عَلٰى قُلُوبِ الَّذٖينَ لَا يَعْلَمُونَ﴿٥٩﴾ فَاصْبِرْ اِنَّ وَعْدَ اللّٰهِ حَقٌّ

---

**56)** (وَقَالَ الَّذٖينَ اُوتُوا الْعِلْمَ وَالْاٖيمَانَ لَقَدْ لَبِثْتُمْ فٖي كِتَابِ اللّٰهِ اِلٰى يَوْمِ الْبَعْثِۘ) **- Müşrik və asilərin cavabında o şəxslər ki, Allah-Təala onlara elm və iman bəxş edib,** (peyğəmbərlər və möminlər) **deyirlər: "Həqiqətən, sizdən ötrü "lövhi-məhfuz"da** (qorunmuş kitab-Allahın elmində) **təqdir olunan qədər dünyada ömür sürüb yaşayıbsınız. Ondan sonra qəbirdə orqanlarınız çürüyüb, lakin bəşəri ünsürünüz qiyamət gününə kimi qalıb, indi Allah-Təala sizə həyat verib məhşərə götürübdür. Bəs niyə deyirsiniz ki, biz dünyada bir saatdan artıq qalmamışıq?** (فَهٰذَا يَوْمُ الْبَعْثِ وَلٰكِنَّكُمْ كُنْتُمْ لَا تَعْلَمُونَ) **- Bu gün geri göndərilib yenidən dirilmək günüdür. Hansı ki siz bu günü inkar edib dünyada bu günün vaqe olmağına elm təhsil etməyib doğru deyən şəxslərin** (peyğəmbərlərin) **sözlərini qəbul etmədiniz. İndi bugünkü gündə sizə heç bir şey fayda verməz".**

**57)** (فَيَوْمَئِذٍ لَا يَنْفَعُ الَّذٖينَ ظَلَمُوا مَعْذِرَتُهُمْ) - (Ey Məhəmməd), **qiyamət günündə zalım şəxslərin zülm və günahları səbəbi ilə üzr istəmələri fayda verməz.**

(وَلَا هُمْ يُسْتَعْتَبُونَ) **- Və onlara deyilməyəcəkdir ki, gəlin tövbə edib Allah-Təalanı özünüzdən razı edin,** (heç bir üzr qiyamət günündə qəbul edilməyəcəkdir).

**58)** (وَلَقَدْ ضَرَبْنَا لِلنَّاسِ فٖي هٰذَا الْقُرْاٰنِ مِنْ كُلِّ مَثَلٍۜ) **- Həqiqətən, biz xalqdan ötrü bu Quranda hər bir qissəni və onların əhvalatlarını və aqibətini bəyan etdik. Onların qəlblərində qatılıq olduğu üçün onlara təsir etmədi.** (وَلَئِنْ جِئْتَهُمْ بِاٰيَةٍ لَيَقُولَنَّ الَّذٖينَ كَفَرُوٓا اِنْ اَنْتُمْ اِلَّا مُبْطِلُونَ) - (Ey Məhəmməd), **əgər onlardan ötrü Qurani-Şərifin ayələrindən bir ayə gətirsən,** (necə ki gətirirsən), **əlbəttə, kafir şəxslər deyirlər: "Siz özünüz yalançı və sözünüz də batildir, yalan sözləri bizdən ötrü gətiribsiniz".**

**59)** (كَذٰلِكَ يَطْبَعُ اللّٰهُ عَلٰى قُلُوبِ الَّذٖينَ لَا يَعْلَمُونَ) - (Ey Məhəmməd), **necə ki bu kafir və müşriklər sənin özünü və sözünü batil deyirlər, habelə Allah-Təala bu cahillərin küfr və cəhalətlərinə görə, onların qəlblərinə bir möhür vurub heç bir vaxt haqqı dərk edib ondan faydalana bilməzlər.**

**60)** (فَاصْبِرْ اِنَّ وَعْدَ اللّٰهِ حَقٌّ) - (Ey Məhəmməd), **səbir et. Allah-Təalanın vədi** (ki, sənə kömək olub islam dinini yayıb səni müşriklərə qalib etsin) **haqdır. Əlbəttə, vaqe olacaqdır.** (Allah-Təala bu vədini Məkkədə öz peyğəmbərinə verdi. Ondan sonra onu Məkkədən çıxarıb vədinə sadiq qalıb onu düşmənlərinə

وَلَا يَسْتَخِفَّنَّكَ الَّذِينَ لَا يُوقِنُونَ ﴿٦٠﴾

qalib etdi. Necə ki Allah Rəsulunun tarixindən bu mətləb açıq-aşkardır). **( وَلَا يَسْتَخِفَّنَّكَ الَّذِينَ لَا يُوقِنُونَ ) -** (Ey Məhəmməd), **Allah-Təalaya və axirətə iman etməyən şəxslərin sözləri səni müdafiə və istiqamətdən dərd və iztiraba salmasın. Onlar zillət içindədirlər, onların özlərinin və sözlərinin Allah-Təala yanında bir zərrə qədər etibarı yoxdur. Sən möhkəm dağlar kimi ehkamı təbliğ etməkdə bərqərar olub tənə edənlərin tənəsinə etina etmə.** (Bu mübarək ayə Allah Rəsulunun şəriət ehkamını təbliğ etməkdə sabit və möhkəm olmağa şiddətlə həvəsləndirir və rəğbət etdirir).

**Həmd Onadır. Rum surəsinin təfsiri tamam oldu. Bu təfsiri Qurani-Şərifin axırına kimi tamamlamaq üçün Allah-Təaladan yardım istəyirəm. Allah Rəsulu buyurubdur: "Ki Rum surəsini oxusa,** (yəni onda olan hikmət və nəsihətlərə diqqət edib təfəkkür edə), **Allah-Təala ona qarşılığında on yaxşılıq bəxş edər".**

## LOĞMAN SURƏSİ

31-ci surədir. Məkkədə nazil olub, 34 ayə, 548 kəlmə və 2110 hərfdir.

الٓمٓ ﴿١﴾ تِلْكَ اٰيَاتُ الْكِتَابِ الْحَكِيمِ ﴿٢﴾ هُدًى وَرَحْمَةً لِلْمُحْسِنِينَ ﴿٣﴾ اَلَّذِينَ يُقِيمُونَ الصَّلٰوةَ وَيُؤْتُونَ الزَّكٰوةَ وَهُمْ بِالْاٰخِرَةِ هُمْ يُوقِنُونَ ﴿٤﴾ اُولٰٓئِكَ عَلٰى هُدًى مِنْ رَبِّهِمْ وَاُولٰٓئِكَ هُمُ الْمُفْلِحُونَ ﴿٥﴾ وَمِنَ النَّاسِ مَنْ يَشْتَرِي لَهْوَ الْحَدِيثِ لِيُضِلَّ عَنْ سَبِيلِ اللّٰهِ بِغَيْرِ عِلْمٍ وَيَتَّخِذَهَا هُزُوًا اُولٰٓئِكَ لَهُمْ عَذَابٌ مُهِينٌ ﴿٦﴾

---

### Bismillahir-Rəhmanir-Rəhim

**1) (الٓمٓ) - Bu surənin adıdır.**

**2) (تِلْكَ اٰيَاتُ الْكِتَابِ الْحَكِيمِ) - Bu surədə bəhs olunan ayələr hikməti ehtiva edən kitabın** (Quranın) **ayələridir. Gərək, o ayələrə diqqət edilib onların hikmətləri dərk olunsun.**

**3-4) (هُدًى وَرَحْمَةً لِلْمُحْسِنِينَ) - Ayələr yaxşı əməl sahiblərindən ötrü hidayət və rəhmətdir. (اَلَّذِينَ يُقِيمُونَ الصَّلٰوةَ وَيُؤْتُونَ الزَّكٰوةَ وَهُمْ بِالْاٰخِرَةِ هُمْ يُوقِنُونَ) - Yaxşı əməl sahibləri o şəxslərdir ki, namazı qılıb zəkatı verib, əlbəttə, axirət gününə iman edirlər.**

**5) (اُولٰٓئِكَ عَلٰى هُدًى مِنْ رَبِّهِمْ وَاُولٰٓئِكَ هُمُ الْمُفْلِحُونَ) - Öz rəbləri Allah-Təala tərəfindən hidayət edilib və əlbəttə, nicat tapanlar bu bəhs olunan şəxslərdir.**

**6) (وَمِنَ النَّاسِ مَنْ يَشْتَرِي لَهْوَ الْحَدِيثِ) -** (Bu mübarək ayə Məkkədə Qüreyş camaatından Nəzr b. əl-Haris və onun kimi şəxslərin haqqında gəlibdir. Bu şəxs İran tərəfinə səfər edib onların tarixini əzbərləyib qayıdıb, Məkkədə Qüreyş camaatına deyirdi ki, əgər Məhəmməd sizə Ad və Səmud camaatının hekayəsini nəql edir, mən də sizdən ötrü Bəhram və Rüstəm, İsfəndiyar hekayələrini nəql edərəm. Xalqın Qurana qulaq asmağına mane olurdu. Ayənin mənası belədir, buyurur:) **Xalqın içində bəziləri vardır ki,** (Nəzr b. əl-Haris və ona tabe olanlar) **çirkin və batil sözləri Qurani-Şərifə üstün sayıb onunla əvəz edirlər. (لِيُضِلَّ عَنْ سَبِيلِ اللّٰهِ بِغَيْرِ عِلْمٍ وَيَتَّخِذَهَا هُزُوًا) - Elm və bəsirətdən məhrum çirkin və batil sözləri Qurana əvəz sayırlar, belə ki, xalqı Allah-Təala yolu - islam dinindən uzaqlaşdırıb islam dininə istehza və məsxərə etsinlər.**

**(اُولٰٓئِكَ لَهُمْ عَذَابٌ مُهِينٌ) - Bunlardan ötrü axirətdə zəlil və rəzil edən əzab hazırlanıbdır.**

وَاِذَا تُتْلٰى عَلَيْهِ اٰيَاتُنَا وَلّٰى مُسْتَكْبِرًا كَاَنْ لَمْ يَسْمَعْهَا كَاَنَّ فٖيٓ اُذُنَيْهِ وَقْرًاۚ فَبَشِّرْهُ بِعَذَابٍ اَلٖيمٍ ﴿٧﴾
اِنَّ الَّذٖينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ لَهُمْ جَنَّاتُ النَّعٖيمِۙ ﴿٨﴾ خَالِدٖينَ فٖيهَاۜ وَعْدَ اللّٰهِ حَقًّا وَهُوَ الْعَزٖيزُ
الْحَكٖيمُ ﴿٩﴾ خَلَقَ السَّمٰوَاتِ بِغَيْرِ عَمَدٍ تَرَوْنَهَا وَاَلْقٰى فِي الْاَرْضِ رَوَاسِيَ اَنْ تَمٖيدَ بِكُمْ وَبَثَّ فٖيهَا
مِنْ كُلِّ دَٓابَّةٍ وَاَنْزَلْنَا مِنَ السَّمَٓاءِ مَٓاءً فَاَنْبَتْنَا فٖيهَا مِنْ كُلِّ زَوْجٍ كَرٖيمٍ ﴿١٠﴾ هٰذَا خَلْقُ اللّٰهِ

---

**7) (وَاِذَا تُتْلٰى عَلَيْهِ اٰيَاتُنَا) - O zaman ki** (Nəzr b. əl-Harisə) **bizim ayələrimiz** (Quranın ayələri oxundu), **(وَلّٰى مُسْتَكْبِرًا كَاَنْ لَمْ يَسْمَعْهَا كَاَنَّ فٖيٓ اُذُنَيْهِ وَقْرًا) -** (Ey Məhəmməd), **o vaxt baxıb görərsən ki, o, təkəbbüründən Qurana arxasını çevirib gedir, guya, Quranın ayələrini eşitmir və guya, qulaqlarında ağırlıq vardır, o səbəbə görə guya eşitmir. Halbuki bunların heç biri deyil, təkəbbüründən Qurana etina etmir. (فَبَشِّرْهُ بِعَذَابٍ اَلٖيمٍ) -** (Ey Məhəmməd), (Nəzr b.əl-Harisi) **qiyamət günündə əziyyət verən əzabla müjdələ.**

**8-9) (اِنَّ الَّذٖينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ لَهُمْ جَنَّاتُ النَّعٖيمِ) - Həqiqətən, o şəxslər ki, Qurana iman gətirib xeyir əməllər edir, onlardan ötrü axirətdə cənnətlər vardır ki, o cənnətlərdə həmişəlik nemətlər içində qalacaqlar.**

**(خَالِدٖينَ فٖيهَاۜ وَعْدَ اللّٰهِ حَقًّا) - O cənnətlərdə həmişə olacaqlar. Allah-Təalanın bu vədi** (cənnətə daxil edib orada həmişə qalmaq) **haqq olan vəddir və vədində xilaf olmaz. (وَهُوَ الْعَزٖيزُ الْحَكٖيمُ ) - Allah-Təala hər bir şeyə qalibdir. Rəhmət və əzabın hər ikisi hikmət və ədalət üzrə ondan meydana gəlir.**

**10) (خَلَقَ السَّمٰوَاتِ بِغَيْرِ عَمَدٍ تَرَوْنَهَا) - Allah-Təala göyləri və yeri necə ki özünüz görürsünüz, dirəksiz və sütunsuz yaradıbdır.**

**(وَاَلْقٰى فِي الْاَرْضِ رَوَاسِيَ اَنْ تَمٖيدَ بِكُمْ) - Yer üzünə uca və möhkəm dağlar saldı ki, qorxmayasanız ki, yer sütunsuz olduğuna görə, bəlkə, sizi iztiraba salıb sizin orada rahatlığınız mümkün olmasın. Bu qorxunu sizdən götürməkdən ötrü Allah-Təala uca dağları yerdə yaratdı ki, o dağların səbəbinə yerin iztirabından arxayın olasınız.** (Bu yerdə bəzi təfsirçilərin məntiqsiz sözləri vardır ki, guya yer su üstündə olduğu üçün həmişə hərəkət edir. Allah-Təala da yerdə dağları yaratdı ki, yer ağırlaşıb, sakit oldu. Belə sözlərdən bəhs etmək mən həqirin adəti deyil. Lakin oxucuların diqqətini cəlb etməkdən ötrü bundan bəhs etdim). **(وَبَثَّ فٖيهَا مِنْ كُلِّ دَٓابَّةٍ) - Yer üzündə hər bir qisim hərəkət edən heyvanatı yaradıb yaydı. Allah-Təaladan başqa heç kim onlardan xəbərdar deyil. (وَاَنْزَلْنَا مِنَ السَّمَٓاءِ مَٓاءً فَاَنْبَتْنَا فٖيهَا مِنْ كُلِّ زَوْجٍ كَرٖيمٍ) - Göylərdən su endirib hər bir növ gözəl otlardan və göyərtilərdən göyərdib yerdən çıxartdıq.** (Bəs bu bəhs edilənlər Allah-Təalanın tövhid və qüdrətinə işarə etmirmi?)

**11) (هٰذَا خَلْقُ اللّٰهِ) -** (Ey Məhəmməd), **müşriklərə de ki, bu bəhs edilənlər**

فَاَرُونِي مَاذَا خَلَقَ الَّذِينَ مِنْ دُونِهِۜ بَلِ الظَّالِمُونَ فِي ضَلَالٍ مُبِينٍ ﴿١١﴾ وَلَقَدْ اٰتَيْنَا لُقْمٰنَ الْحِكْمَةَ
اَنِ اشْكُرْ لِلّٰهِۜ وَمَنْ يَشْكُرْ فَاِنَّمَا يَشْكُرُ لِنَفْسِهِۚ وَمَنْ كَفَرَ فَاِنَّ اللّٰهَ غَنِيٌّ حَمِيدٌ ﴿١٢﴾ وَاِذْ قَالَ لُقْمٰنُ
لِابْنِهِ وَهُوَ يَعِظُهُ يَا بُنَيَّ لَا تُشْرِكْ بِاللّٰهِۜ اِنَّ الشِّرْكَ لَظُلْمٌ عَظِيمٌ ﴿١٣﴾

---

**Allah-Təalanın məxluqlarıdır.** (فَاَرُونِي مَاذَا خَلَقَ الَّذِينَ مِنْ دُونِهِ) **- Bəs Allah-Təaladan başqa, sizin ibadət etdikləriniz nə yaradıblar? Onu mənə göstərin.** (بَلِ الظَّالِمُونَ فِي ضَلَالٍ مُبِينٍ) **- Əlbəttə, onların ibadət etdikləri şeylərin bir şey icad etməyə qüdrətləri yoxdur. Bəlkə, zalım müşriklər bütlərə ibadət etdikləri üçün açıq-aşkar zillətdədirlər.** (Loğman Baura oğlu qaramtıl və elm və hikmət sahibi bir şəxs idi. Davud peyğəmbəri görüb onun elmindən istifadə etmişdi və həm də yunan filosoflarından Pifaqoru görüb ona tələbəlik etmişdi. Elmin şərəfinə bu kifayət edər ki, Loğmanın adı bu zamana kimi cəmi dillərdə və Qurani-Şərifdə bəhs edilib bundan sonra qiyamətə kimi də bəhs ediləcəkdir. Bəzi tarixçilərin yazdığına görə, Loğman qul idi. Ağası ona əmr etdi ki, bir qoyun kəsib onun iki yaxşı və gözəl hissəsini onun üçün gətirsin. Loğman qoyunu kəsib onun dili ilə qəlbini ağasına apardı. Loğmanın ağası bunun sirrini soruşdu. Loğman dedi: "Əgər bu iki üzv pak olub, onlardan yaxşı, gözəl fikirlər, sözlər çıxarsa, cəmi orqanların yaxşısı onlar olar. Əgər xəbis olsalar, cəmi orqanların xəbisi və murdarı onlar olar). **Tabeinin** (peyğəmbərin səhabəsini görənlər) **məşhurlarından olan Səid ibn Müseyyib bir qara şəxsə dedi: "Qara olmağından kədərlənmə, xalqın içindən 3 yaxşı nəfər qara idi: 1) Loğman 2) Allah Rəsulunun müəzzini Bilal 3) Ömər ibn Xəttabın qulu Mihca".** (Bədir savaşında şəhid oldu). Loğmanın fəzilət və mənqəbələri çoxdur. Hamısından artığı – Allah-Təalanın onun oğluna etdiyi nəsihəti Qurani-Şərifdə anlatması onun fəzilətinə kifayət edər. Necə ki, sıradakı mübarək ayədə bunu xəbər verir).

**12)** (وَلَقَدْ اٰتَيْنَا لُقْمٰنَ الْحِكْمَةَ اَنِ اشْكُرْ لِلّٰهِ) **- Həqiqətən, biz Loğmana hikməti (hər bir şeyin həqiqətinə agah olmağı) bəxş edib ona əmr etdik:** (mübarək ağlına yerləşdirdik). **"Ey Loğman, bu hikmətin müqabilində Allah-Təalaya şükür et.** (وَمَنْ يَشْكُرْ فَاِنَّمَا يَشْكُرُ لِنَفْسِهِ) **- Kim Allah-Təalaya şükür etsə, öz nəfsinin mənfəəti üçün şükür etmiş olacaq. O şükrün mənfəəti onun öz nəfsinə aid olur.** (وَمَنْ كَفَرَ فَاِنَّ اللّٰهَ غَنِيٌّ حَمِيدٌ) **- Və kim ki, Allah-Təalaya kafir olub şükür etməsə, onun kafir olmasının günahının əzabı onun öz nəfsinə aiddir, həqiqətən, Allah-Təala şükür edənlərin şükrünə möhtac deyil. Ona heç həmd edən olmasa da, həmd-səna olunmağa layiqdir".**

**13)** (وَاِذْ قَالَ لُقْمٰنُ لِابْنِهِ وَهُوَ يَعِظُهُ) **- Yadına sal,** (Ey Məhəmməd), **o zaman ki Loğman oğluna nəsihət edərək dedi:** (يَا بُنَيَّ لَا تُشْرِكْ بِاللّٰهِۜ اِنَّ الشِّرْكَ لَظُلْمٌ عَظِيمٌ) **- "Ey mənim oğulcuğum.** (Ata öz oğluna mərhəmət üçün oğulcuğum deyir, ərəb – ya büneyyə, fars – pəsərkum deyir). **Allah-Təalaya şirk qoşma, həqiqətən,**

وَوَصَّيْنَا الْاِنْسَانَ بِوَالِدَيْهِۚ حَمَلَتْهُ اُمُّهُ وَهْنًا عَلٰى وَهْنٍ وَفِصَالُهُ فِي عَامَيْنِ اَنِ اشْكُرْ لِي وَلِوَالِدَيْكَۜ اِلَيَّ الْمَص۪يرُ ﴿١٤﴾ وَاِنْ جَاهَدَاكَ عَلٰٓى اَنْ تُشْرِكَ ب۪ي مَا لَيْسَ لَكَ بِه۪ عِلْمٌ فَلَا تُطِعْهُمَا وَصَاحِبْهُمَا فِي الدُّنْيَا مَعْرُوفًاۘ وَاتَّبِعْ سَب۪يلَ مَنْ اَنَابَ اِلَيَّۚ ثُمَّ اِلَيَّ مَرْجِعُكُمْ فَاُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ تَعْمَلُونَ ﴿١٥﴾ يَا بُنَيَّ اِنَّهَٓا اِنْ تَكُ مِثْقَالَ حَبَّةٍ مِنْ خَرْدَلٍ فَتَكُنْ ف۪ي صَخْرَةٍ اَوْ فِي السَّمٰوَاتِ اَوْ فِي الْاَرْضِ يَأْتِ بِهَا اللّٰهُۜ

---

**Allah-Təalaya şirk qoşmaq böyük zülmdür".** (Əlbəttə, zəlil məxluqu əziz və nemət sahibi yeganə Yaradıcıya bərabər saymaqdan böyük zülm olmaz). **Bundan sonra gələn iki mübarək ayə Loğmanın vəsiyyəti əsnasında oğluna şirki təkidlə qadağan etməsi haqqında vaqe olub.**

**14) (وَوَصَّيْنَا الْاِنْسَانَ بِوَالِدَيْهِۚ) - Cəmi peyğəmbərlərin vasitəsilə Adəm nəslindən olan insana vəsiyyət edib ata və anasını tapşırmışıq, xüsusən, anasını. (حَمَلَتْهُ اُمُّهُ وَهْنًا عَلٰى وَهْنٍ) - İnsana anası hamilə olarkən qat-qat zəifləyər. Hamiləlik müddəti qabağa getdikcə çətinliyi və zəifliyi artar. (وَفِصَالُهُ فِي عَامَيْنِ) - Və hamiləlikdən sonra iki il** (uşağa süd vermək iki ildir), **ya iki ildən az uşağa süd verib ondan sonra onu süddən ayırar, bu zəhmətləri xüsusən ana uşaqdan ötrü çəkər. (اَنِ اشْكُرْ لِي وَلِوَالِدَيْكَۜ اِلَيَّ الْمَص۪يرُ) - Vəsiyyətimiz insana bu oldu ki, mənə nemətlərin müqabilində, ata və ananıza sizdən ötrü çəkdikləri zəhmətlərin müqabilində şükür edin. Çünki hamınızın qayıdacağı yer mənim tərəfimə olacaqdır. İtaət edib etməyənlərin qarşılığını mən verəcəyəm.**

**15) (وَاِنْ جَاهَدَاكَ عَلٰٓى اَنْ تُشْرِكَ ب۪ي مَا لَيْسَ لَكَ بِه۪ عِلْمٌ فَلَا تُطِعْهُمَا) - Ey insan, əgər sənin ata və anan müşrik olub səninlə mücadilə edib mənə şirk qoşsa da, (وَصَاحِبْهُمَا فِي الدُّنْيَا مَعْرُوفًاۘ) - o müşrik ata-ana ilə dünyada yaxşılıq və gözəlliklə həmsöhbət olub, onlarla qohumluq əlaqəsi saxlayıb, şirkdən başqa hər bir işdə onlara itaət et.** (Ata və ananın haqqı böyük və uca olduğu üçün müşrik olsalar da, şirkdən başqa, hər bir işdə Allah-Təala onlara itaəti lazım və vacib sayır). **Qurani-Şərifdə dərc olunan itaət edilməsi vacib olan ehkama görə, müsəlmanların iftixar etməsi lazımdır.**

**(وَاتَّبِعْ سَب۪يلَ مَنْ اَنَابَ اِلَيَّ) - Ey insan oğlu, şirkdə ata və anaya itaət etməyib mənim tərəfimə dönüb itaət edən şəxslərin** (peyğəmbərlər və övliyaların) **yoluna tabe olun. (ثُمَّ اِلَيَّ مَرْجِعُكُمْ فَاُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ تَعْمَلُونَ) - Dünyada ölümü dadandan sonra hamınızın qayıdacağı yer mənim tərəfim olacaqdır. O vaxt dünyada etdiyiniz əməllərinizi bir-bir sizə xəbər verib hər bir şəxsin əməlinin qarşılığını özünə verəcəyəm.** (Bəhs olunan ayələrdə Loğmanın şirki təkidlə qadağan etməsi anladılıb, Loğmanın vəsiyyətinə geri dönülür).

**16) (يَا بُنَيَّ اِنَّهَٓا اِنْ تَكُ مِثْقَالَ حَبَّةٍ مِنْ خَرْدَلٍ) - Ey mənim oğulcuğum.** (Loğman deyir:) **İnsandan meydana gələn xeyir və şər əməllər əgər bir xardal dənəsi ağırlığında da olsa, (فَتَكُنْ ف۪ي صَخْرَةٍ) - o xardal dənəsi qədər əməl də etmiş olsa, (اَوْ فِي السَّمٰوَاتِ اَوْ فِي الْاَرْضِ يَأْتِ بِهَا اللّٰهُ) - ya da ki o əməl göylərdə və ya yerin**

اِنَّ اللّٰهَ لَطِيفٌ خَبِيرٌ ﴿١٦﴾ يَا بُنَيَّ اَقِمِ الصَّلٰوةَ وَاْمُرْ بِالْمَعْرُوفِ وَانْهَ عَنِ الْمُنْكَرِ وَاصْبِرْ عَلٰى مَٓا
اَصَابَكَۜ اِنَّ ذٰلِكَ مِنْ عَزْمِ الْاُمُورِۚ ﴿١٧﴾ وَلَا تُصَعِّرْ خَدَّكَ لِلنَّاسِ وَلَا تَمْشِ فِي الْاَرْضِ مَرَحًاۜ اِنَّ
اللّٰهَ لَا يُحِبُّ كُلَّ مُخْتَالٍ فَخُورٍۚ ﴿١٨﴾ وَاقْصِدْ فِي مَشْيِكَ وَاغْضُضْ مِنْ صَوْتِكَۜ اِنَّ اَنْكَرَ الْاَصْوَاتِ
لَصَوْتُ الْحَمِيرِۚ ﴿١٩﴾

---

**dərinliklərində olmuş olsa, Allah-Təala o əməlləri qiyamət günündə götürüb sahibinə qarşılığını verəcəkdir. (اِنَّ اللّٰهَ لَطِيفٌ خَبِيرٌ) - Həqiqətən, Allah-Təalanın elmi hər bir şeyi əhatə edir və hər bir şeyin mahiyyətindən agahdır.**

**17) (يَا بُنَيَّ اَقِمِ الصَّلٰوةَ وَاْمُرْ بِالْمَعْرُوفِ وَانْهَ عَنِ الْمُنْكَرِ) - Ey mənim oğulcuğum, namaz böyük ibadətdir. Onu tərk etməyib öz vaxtında qıl.** (Hər bir peyğəmbərin şəriətində namaz olub, lakin üsulu müxtəlif olubdur) **və xeyri əmr, şəri qadağan etməyə çalış. (وَاصْبِرْ عَلٰى مَٓا اَصَابَكَ) - Hər bir məqamda düçar olduğun müsibətlərə səbir et. (اِنَّ ذٰلِكَ مِنْ عَزْمِ الْاُمُورِ) - Həqiqətən, bu bəhs edilən əməllər Allah-Təala tərəfindən onların vacib və lazım olmaları üçün buyurulmuşdur ki, heç vaxt dəyişilməyib vacib olmaqdan çıxmazlar.**

**18) (وَلَا تُصَعِّرْ خَدَّكَ لِلنَّاسِ) -** (Loğman oğluna deyir:) **təkəbbürlənib, təkəbbürlülər kimi xalqdan üz çevirmə, bəlkə, təvazökarlıq edib xalqa xoş sifət göstər. (وَلَا تَمْشِ فِي الْاَرْضِ مَرَحًا) - Yer üzündə tənbəllik və pislik edib təkəbbürlə yol getmə.** (Necə ki yer üzündə insanların əksəriyyətinin hərəkətləri bunun kimidir). **(اِنَّ اللّٰهَ لَا يُحِبُّ كُلَّ مُخْتَالٍ فَخُورٍ) - Həqiqətən, Allah-Təala təkəbbürlənib, xalqa qarşı lovğalananları dost saymaz.**

**19) (وَاقْصِدْ فِي مَشْيِكَ وَاغْضُضْ مِنْ صَوْتِكَ) -** (Loğman deyir oğluna:) **Yer üzündə hərəkət edib yol gedəndə mötədil şəkildə get. Nə məğrurlar kimi son dərəcə yavaş get, nə bəzi cahillər kimi təcili, sürətlə get, amma bu ikisinin arasında mötədil şəkildə get və danışan zamanda da səsini ucaltmayıb yavaşca çıxart. Ucadan danışmaq yaxşı* iş deyil.**

**(اِنَّ اَنْكَرَ الْاَصْوَاتِ لَصَوْتُ الْحَمِيرِ) - Əgər ucadan səs çıxardıb çığırmaq yaxşı olsaydı, gərək eşşəyin səsi yaxşı olaydı, halbuki həqiqətən də səslərin ən çirkini və vəhşisi əlbəttə ki, eşşəyin səsidir. İnsanlığın şərti odur ki, şəxs danışanda gərək ədəbini qoruyub təvazökarlıq edib səsinə mülayimlik versin.**

*(*Qeyd:* *Loğmanın bu nəsihətləri layiqdir ki, qızıl suyu ilə yazılıb insanlıq aləminə daxil olan şəxslər həmişə gözlərinin qabağında saxlayıb faydalansınlar. Loğmanın bu nəsihətlərini Allah-Təalanın Qurani-Şərifdə Allah Rəsulunun möcüzəli dili ilə bəyan edib Qurani-Şərifə əbədiyyən qoymasından məqsəd ancaq hekayə və qissə nəql etmək deyil. Bəlkə (Cəlaləddin) Ruminin dediyi kimi:*

**Kəşfül-Həqayiq III**

*“Daha yaxşısı budur ki, dilbərlərin sirri*
*Başqalarının hekayətində deyilsin”*

*O nəsihətləri və gözəl vəsfləri Loğmanın hekayəsində rəmzlə bizə anlatmasından məqsəd insanlara daha çox təsir edən misal və hekayə içində əsl mətləbi bəyan etmək olub, Allah-Təala bu gözəl sifətləri Loğman hekayəsində bəyan etmişdir. Amma yüzlərlə dəfə heyif ki, islam ümməti qəflət yuxusuna elə qərq olmayıblar ki, bu uca mətləblərdən faydalanıb və bu gözəl vəsfləri əldə edib insanlıq dairəsinə qədəm qoysunlar. İslam ümmətinin əksəriyyəti Qurani-Şərifdən elə hürküblər ki, guya, Qurani-Şərif onların kitabı deyil və ona əməl etməklə vəzifəli deyillər, guya, bu, bir kitabdır ki, ölülər üstündə, ya da ki mübarək Ramazanda digər dualar kimi (Əbu Həmzə duası, cövşəni-kəbir, duayi-simat, duayi-əşərat və digərləri) kimi, gərək, oxunsun, əlbəttə, bu mətləb elm sahiblərinə aydındır ki, avam camaatın Qurani-Şərifdən hürküb ondan qaçmalarının baiskarı özləri deyil. Əlbəttə bu işin baiskarları vardır. O səbəbkarlar din və ümmətin düşmənləridir. Belə ki bunlar ümmət arasından qovulmasa, bu ümmətin qurtuluşu imkansızdır. Qurani-Şərif dini təlim-tərbiyə, mədəniləşmə və əxlaqı gözəlləşdirmənin zirvəsinə çatmağa kafi olan bir kitabdır, hətta Qurani-Şərifin bir ayəsi də tamamilə maarif aləminə daxil olub nəfsi tərbiyə etməyə kafi olub bunun əlacıdır. Pis niyyətli yalançı alimlər başlanğıcdan etibarən öz işlərinin xeyri üçün Qurani-Şərifi xalq üçün anlaşılmaz, qeyri-müəyyən elan edib, onun mətləblərinin dərk edilməsini peyğəmbərə, ya da ki Ruhülqüdsə (Cəbrayıl), ya da imamlara həvalə edib avam camaatı ondan uzaqlaşdırıblar. Belə ki, xalq Qurani-Şərifin mətləblərini dərk etməyib özlərinin pis niyyətləri yerinə yetirilib, eyibləri gizli qalsın. Amma günəşin nurunu palçıqla örtmək imkansızdır. (Allahın nurunu ağızları ilə (üfləyib) söndürmək istəyirlər. Halbuki kâfirlər xoşlanmasalar da, Allah nurunu tamamlamaqdan əsla imtina etməyəcəkdir). Qurani-Şərifin qarşısında öz rəyini bildirib: “Doğrudur, Allah-Təalanın Quranında belə buyurulub, amma mənim rəyim belədir”, -deməkdən artıq küfr və şirk varmı? İslam ümməti hər bir işlərini gərək, Qurana bağlı edib danışsınlar, nəinki Quranın açıq-aydın ayələrinin hökmünü tərk edib onun xilafına hökm versinlər. Quranın xilafına hökm verib və o hökmləri Allah Rəsuluna, səhabəsinə və hidayətverici imamlara isnad verənlərə müsəlman adını vermək olarmı? İslam ümmətinə dini rəhbərlik iddiasında olub, həqiqətdə isə islam ümmətini zillətə salan şəxslər nə qədər ki, islah olunmayıblar, ümmət günbəgün geri gedib məhv olacaqdır. Amma Allaha həmd (şükür və tərif) olsun, bu zamanda islam ümmətində ildırım kimi anidən zühur edən bir aydınlanma hiss olunur. Ümid edirik ki, bundan sonra mədəniyyət və maarifçilik onların arasında da yayılıb, qopmaz ip olan Qurana sarılıb qurtuluşa çatsınlar. Bundan sonra dünyaya gəlib, gələcəkdə*

اَلَمْ تَرَوْا اَنَّ اللّٰهَ سَخَّرَ لَكُمْ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ وَاَسْبَغَ عَلَيْكُمْ نِعَمَهُ ظَاهِرَةً وَبَاطِنَةً
وَمِنَ النَّاسِ مَنْ يُجَادِلُ فِي اللّٰهِ بِغَيْرِ عِلْمٍ وَلَا هُدًى وَلَا كِتَابٍ مُنِيرٍ ﴿٢٠﴾ وَاِذَا قِيلَ لَهُمُ اتَّبِعُوا مَٓا
اَنْزَلَ اللّٰهُ قَالُوا بَلْ نَتَّبِعُ مَا وَجَدْنَا عَلَيْهِ اٰبَٓاءَنَاۜ اَوَلَوْ كَانَ الشَّيْطَانُ يَدْعُوهُمْ اِلٰى عَذَابِ السَّعِيرِ﴿٢١﴾

---

*maarif dünyasına qədəm qoyub, bu bəyənilən kitaba baxan saf qardaşlarıma sonsuz dua və salam göndərib, ümmət içində maarifi yaymağı onlara tövsiyə edirəm. (Allahım! Sən bu insanları dinində təqvalı olmada müvəffəq et!)*

**20) (**اَلَمْ تَرَوْا اَنَّ اللّٰهَ سَخَّرَ لَكُمْ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ**) - Ey insan oğlu, bəs baxıb görmürsən ki, həqiqətən də göylərdə olan şeyləri** (günəş, ay, ulduzlar və onlardan başqa səmada var olan varlıq) **və yerdə olan şeyləri** (dənizlər və çaylar, maddələr, heyvanat, bitkilər və saysız şeylər) **Allah-Təala sizdən ötrü yaradıb, sizə tabe edibdir. (**وَاَسْبَغَ عَلَيْكُمْ نِعَمَهُ ظَاهِرَةً وَبَاطِنَةً**) - Allah-Təala siz insan nəsli* üçün zahir və batini nemətlərini tamamlayıbdır. (**وَمِنَ النَّاسِ مَنْ يُجَادِلُ فِي اللّٰهِ بِغَيْرِ عِلْمٍ وَلَا هُدًى وَلَا كِتَابٍ مُنِيرٍ**)** - (Ey Məhəmməd), **xalqın içindən bəziləri Allah-Təala haqqında elmsiz və hidayətsiz, nurani olan kitabsız və dəlilsiz mücadilə edib Allah-Təalaya şirk qoşurlar.** (Necə ki Məkkə əhli olan müşriklər peyğəmbər ilə Allah-Təala haqqında mübahisə və mücadilə edib tövhidi inkar etdilər).

*(****Qeyd:*** *Zahiri olan nemətlər odur ki, hər bir şəxs onları dərk edib agah olar, amma batini nemətlərin bəzilərinə ancaq diqqətlə təfəkkür edən şəxslər agah olub onun həqiqətinə çata bilərlər. Necə ki əşyanın xüsusiyyətini dərk edən təbiət alimləri təbiət elmində kamil olub maddəyə qoyulan elm xüsusiyyətləri vasitəsilə məlum ediblər ki iki maddənin bir-birinə yaxınlaşmağından ya cazibə, ya da dəf etmə qüvvəsi yaranıb, onlardan kainatda qəribə şeylər meydana gəlir. Hansı ki, ilk yaradılışda zühur etməmişdi. Bunlardan böyük nemət olmaz. Allah-Təalanın bu nemətləri qurtaran deyil. Getdikcə zəmanə inkişaf edib öz övladlarına (ah, islam ümmətindən başqa) nizam verib onları kamillik mərtəbəsinə yetişdirir. Allah-Təala maddənin yaradılması ilə əmanət edilən gözəl nemətləri insan nəslinin vasitəsilə ortaya çıxarıb dünya aləminə daxil edir. Maddənin getdikcə yeniləşən xüsusiyyətləri qurtarmayacaqdır. (Onun yaratdıqlarındakı hikmət nə ucadır).*

**21) (**وَاِذَا قِيلَ لَهُمُ اتَّبِعُوا مَٓا اَنْزَلَ اللّٰهُ**)** - (Ey Məhəmməd), **o zaman ki deyildi, (sən dedin) müşriklərə - o Quranı ki Allah-Təala göndəribdir, ona tabe olun. (**قَالُوا بَلْ نَتَّبِعُ مَا وَجَدْنَا عَلَيْهِ اٰبَٓاءَنَاۜ**)** - (Ey Məhəmməd), **sənin cavabında dedilər: “Qurana tabe olmarıq, bəlkə,* tabe olarıq o din və məzhəbə ki, ata-babalarımızı o din və məzhəbdə və bütpərəstlikdə tapmışıq”.**

**(**اَوَلَوْ كَانَ الشَّيْطَانُ يَدْعُوهُمْ اِلٰى عَذَابِ السَّعِيرِ**)** - (Ey Məhəmməd), **bu müşriklər ata-babalarını təqlid edirlər, Allah-Təala göndərən Qurana və haqq yo-**

وَمَنْ يُسْلِمْ وَجْهَهُ اِلَى اللّٰهِ وَهُوَ مُحْسِنٌ فَقَدِ اسْتَمْسَكَ بِالْعُرْوَةِ الْوُثْقٰىۜ وَاِلَى اللّٰهِ عَاقِبَةُ الْاُمُورِ
﴿٢٢﴾ وَمَنْ كَفَرَ فَلَا يَحْزُنْكَ كُفْرُهُۜ اِلَيْنَا مَرْجِعُهُمْ فَنُنَبِّئُهُمْ بِمَا عَمِلُواۜ اِنَّ اللّٰهَ عَلٖيمٌ بِذَاتِ الصُّدُورِ
﴿٢٣﴾ نُمَتِّعُهُمْ قَلٖيلًا ثُمَّ نَضْطَرُّهُمْ اِلٰى عَذَابٍ غَلٖيظٍ ﴿٢٤﴾ وَلَئِنْ سَاَلْتَهُمْ مَنْ خَلَقَ السَّمٰوَاتِ
وَالْاَرْضَ لَيَقُولُنَّ اللّٰهُۜ

---

**luna tabe olmurlar. Bəs onların şeytan ata-babaları onları cəhənnəm əzabına tərəf dəvət edib onları əzaba salsa da, yenə onları təqlid edib tabe olacaqlar. Ağıllı adamdan belə şey meydana gəlməz. Bir şəxs digər şəxsə yaxşı və gözəl əmrdə tabe olar, nəinki küfr və zillətdə. Onlar özlərini ağıllı sayırlar, halbuki bu, səfehlərin əməlidir.**

*(*Qeyd: Xalqın əksəriyyətini həlak edən təqliddir, bizim bu zamanda əgər xalqa desən ki, Allah-Təala filan hökmü Qurani-Şərifdə belə verib. O hökm onun etiqadına zidd olduğu üçün deyərlər: "Biz ata-babalarımızı belə görmüşük, bəs onlar zillətdə olub bilməyiblər. Biz ata-baba yolundan qayıdan deyilik". Bizim zamanda bu sözləri deyənlərlə keçmiş müşriklər arasında heç bir fərq yoxdur. Çox şeylər bizim aramızda müşriklərin adəti kimi adət-ənənəyə çevrilib, ata-babanı təqlid edib onlara məhkum olmuşuq. Gərək, təqlidi kənara qoyub dəlilə tabe olaq. Təqlid insanı zillətə salandır. Bu mübarək ayə və bundan başqa olan ayələr təqlidin batil olmasına açıq-aşkar dəlildir).*

**22) (وَمَنْ يُسْلِمْ وَجْهَهُ اِلَى اللّٰهِ وَهُوَ مُحْسِنٌ) - Kim ki nəfsini Allah-Təalaya həvalə edib hər bir əmrində Allah-Təalaya təvəkkül etsə və özü də xeyir əməl sahibi olsa, (فَقَدِ اسْتَمْسَكَ بِالْعُرْوَةِ الْوُثْقٰىۜ) - həqiqətən, belə bir şəxs bir möhkəm ipə yapışıbdır ki, o ip heç vaxt qopmayacaqdır. (وَاِلَى اللّٰهِ عَاقِبَةُ الْاُمُورِ) - Və hər bir işin qayıdacağı yer Allah-Təala tərəfinədir.**

**23) (وَمَنْ كَفَرَ فَلَا يَحْزُنْكَ كُفْرُهُ)** - (Ey Məhəmməd), **kim kafir olub sənə itaət etməsə, onun kafir olmağı səni məhzun və qəmgin etməsin. (اِلَيْنَا مَرْجِعُهُمْ فَنُنَبِّئُهُمْ بِمَا عَمِلُواۜ) - Onların hamısının qayıdacağı yer bizim tərəfimizədir. Qiyamət günündə onlara yenidən həyat verəndən sonra dünyada etdikləri əməllərini onlara xəbər verib əməllərinin cəzasını onlara yetirəcəyik. (اِنَّ اللّٰهَ عَلٖيمٌ بِذَاتِ الصُّدُورِ) - Həqiqətən də, Allah-Təala bəndələrinin sinələrində olan sirlərə özü agahdır. Buna görə də onlarla rəftar edəcəkdir.**

**24) (نُمَتِّعُهُمْ قَلٖيلًا)** - (Ey Məhəmməd), **kafir və müşriklərə dünyada az bir zaman möhlət verərik ki, dünya nemətlərindən ləzzət alsınlar. (ثُمَّ نَضْطَرُّهُمْ اِلٰى عَذَابٍ غَلٖيظٍ) Ölüm onlara gələndən sonra zorla və məcburən onlara şiddətli əzab edərik ki, əbədiyyən oradan çıxa bilməsinlər.**

**25) (وَلَئِنْ سَاَلْتَهُمْ مَنْ خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ لَيَقُولُنَّ اللّٰهُۜ)** - (Ey Məhəmməd), **əgər**

قُلِ الْحَمْدُ لِلّٰهِ ۜ بَلْ اَكْثَرُهُمْ لَا يَعْلَمُونَ ﴿٢٥﴾ لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِ ۜ اِنَّ اللّٰهَ هُوَ الْغَنِيُّ الْحَمِيدُ
﴿٢٦﴾ وَلَوْ اَنَّ مَا فِي الْاَرْضِ مِنْ شَجَرَةٍ اَقْلَامٌ وَالْبَحْرُ يَمُدُّهُ مِنْ بَعْدِهِ سَبْعَةُ اَبْحُرٍ مَا نَفِدَتْ كَلِمَاتُ
اللّٰهِ اِنَّ اللّٰهَ عَزِيزٌ حَكِيمٌ ﴿٢٧﴾ مَا خَلْقُكُمْ وَلَا بَعْثُكُمْ اِلَّا كَنَفْسٍ وَاحِدَةٍ ۜ

---

**müşriklərdən soruşasan ki, bu göyləri və yerləri yaradan kimdir? Əlbəttə, deyəcəklər ki, Allah-Təaladır.** (Müşriklər bütləri Allah-Təalaya şərik saysalar da, Allah-Təalanın varlığı təkbaşına yaratdığını qəbul edirdilər. Ancaq bütləri Allah-Təalanın yanında özləri üçün şəfaətçi sayırdılar).

**(قُلِ الْحَمْدُ لِلّٰهِ) -** (Ey Məhəmməd), **elə ki, təsdiq etdilər, göyləri və yeri yaradan Allah-Təaladır, de ki, həmd-səna bir olan Allah-Təalaya layiqdir və vacibdir ki, ona həmd olunub ondan qeyrisinə ibadət edilməsin. Belə olan halda, Allah-Təaladan başqasına necə ibadət edərsiniz?**

**(بَلْ اَكْثَرُهُمْ لَا يَعْلَمُونَ) - Bəlkə, onların əksəriyyəti Allah-Təalanın göyləri və yeri yaratmasını təsdiq edərkən agah deyildilər ki, gərək, ona ibadət edib, qeyrisini ona şərik saymasınlar. Cəhalət və nadanlıq haqqı dərk etməkdən onları kor edibdir.** (Bəli, cəhalət dərdi dərmansız müalicə olunan xəstəlik deyildir).

**26) (لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِ ۜ اِنَّ اللّٰهَ هُوَ الْغَنِيُّ الْحَمِيدُ) - Göylərdə və yerdə olan məxluqatın hamısı Allah-Təalanın mülkü və onun idarəsi altındadır. Lakin həqiqətən, Allah-Təalanın məxluqata ehtiyacı yoxdur və həmd-səna olunmağa layiq və münasibdir.**

**27) (وَلَوْ اَنَّ مَا فِي الْاَرْضِ مِنْ شَجَرَةٍ اَقْلَامٌ) -** (Ey Məhəmməd), **həqiqətən, yer üzündə olan ağaclar hamısı qələm olsa, (وَالْبَحْرُ يَمُدُّهُ مِنْ بَعْدِهِ سَبْعَةُ اَبْحُرٍ) - dəniz mürəkkəb olub, ondan başqa, onun kimi yeddi dəniz də mürəkkəb olub ona kömək etsə, (مَا نَفِدَتْ كَلِمَاتُ اللّٰهِ) - bütün varlıq da yazan olsa, heç bir halda Allah-Təalanın kəlmələri qurtaran deyil.** (Kəlmələrdən məqsəd elmdir, elm kəlmə ilə ifadə edildiyinə görə, elmi kəlmələr ilə ifadə edən Allah-Təalanın elmi və məlumatı sonsuz olub yazmaqla qurtaran deyil. Dünyada insan nəslinin əldə etdiyi elmlər Allah-Təalanın elmi ilə müqayisədə okeanın müqabilindəki bir damla kimidir). **(اِنَّ اللّٰهَ عَزِيزٌ حَكِيمٌ) - Həqiqətən, Allah-Təala məxluqata qalibdir, hikmət üzrə hər bir şeyi yaradıb, heç bir şey onun elm və hikmətindən xaric deyil.**

**28) (مَا خَلْقُكُمْ وَلَا بَعْثُكُمْ اِلَّا كَنَفْسٍ وَاحِدَةٍ ۜ) - Siz insan nəslinin bu qədər çoxluqla yaradılıb dünya aləminə gəlməyiniz və ondan sonra yenidən qiyamət günündə dirilməniz məgər Allah-Təalanın qüdrətində deyilmi? Bir nəfsin və ya çoxlu nəfslərin həyat tapıb yaradılması Allah-Təalanın qüdrətində eynidir. Bir nəfsin yaradılmasına qadir olduğu kimi, bütün nəfsləri yarat-**

اِنَّ اللّٰهَ سَم۪يعٌ بَص۪يرٌ ﴿٢٨﴾ اَلَمْ تَرَ اَنَّ اللّٰهَ يُولِجُ الَّيْلَ فِي النَّهَارِ وَيُولِجُ النَّهَارَ فِي الَّيْلِ وَسَخَّرَ الشَّمْسَ
وَالْقَمَرَ كُلٌّ يَجْر۪ٓي اِلٰٓى اَجَلٍ مُسَمًّى وَاَنَّ اللّٰهَ بِمَا تَعْمَلُونَ خَب۪يرٌ ﴿٢٩﴾ ذٰلِكَ بِاَنَّ اللّٰهَ هُوَ الْحَقُّ وَاَنَّ
مَا يَدْعُونَ مِنْ دُونِهِ الْبَاطِلُ وَاَنَّ اللّٰهَ هُوَ الْعَلِيُّ الْكَب۪يرُ ﴿٣٠﴾ اَلَمْ تَرَ اَنَّ الْفُلْكَ تَجْر۪ي فِي الْبَحْرِ
بِنِعْمَتِ اللّٰهِ لِيُرِيَكُمْ مِنْ اٰيَاتِه۪ اِنَّ ف۪ي ذٰلِكَ لَاٰيَاتٍ لِكُلِّ صَبَّارٍ شَكُورٍ ﴿٣١﴾ وَاِذَا غَشِيَهُمْ مَوْجٌ
كَالظُّلَلِ دَعَوُا اللّٰهَ مُخْلِص۪ينَ لَهُ الدّ۪ينَ

---

**mağa da qadirdir. (اِنَّ اللّٰهَ سَم۪يعٌ بَص۪يرٌ) - Həqiqətən, Allah-Təala eyni zamanda eşidilən şeyləri eşidib, görünən şeyləri görür. Eşitmək görməkdən, görmək eşitməkdən Allah-Təalanı məşğul etməz.**

**29) (اَلَمْ تَرَ اَنَّ اللّٰهَ يُولِجُ الَّيْلَ فِي النَّهَارِ وَيُولِجُ النَّهَارَ فِي الَّيْلِ)** - (Ey Məhəmməd), **Bəs Allah-Təalanın kamil qüdrətinə dəlil olan bütün ayələrə baxıb görmürsən ki, həqiqətən də Allah-Təala gecənin zülmətini gündüzün işığına daxil edib qaranlığı məhv və yox edir, gündüz işığını gecə qaranlığına daxil edib işığı məhv və yox edir. Bunlar Allah-Təalanın qüdrətinə dəlil deyilmi? (وَسَخَّرَ الشَّمْسَ وَالْقَمَرَ كُلٌّ يَجْر۪ٓي اِلٰٓى اَجَلٍ مُسَمًّى) - Allah-Təala öz kamil qüdrəti ilə gün və ayı siz insan nəslinin mənfəətinə tabe edib onlardan hər biri təqdir edilən müəyyən vaxta kimi artıq və əskiklik olmadan seyr və hərəkət edib vaqe olarlar,** (qiyamət günü vaxtları tamam olub rəngləri saralıb fani olacaqlar). **(وَاَنَّ اللّٰهَ بِمَا تَعْمَلُونَ خَب۪يرٌ) - Həqiqətən, Allah-Təala siz insan nəslinin hər bir əməlindən agah və xəbərdardır. Çirkin əməl sahiblərinə çirkin qarşılıq verəcəkdir.**

**30) (ذٰلِكَ بِاَنَّ اللّٰهَ هُوَ الْحَقُّ وَاَنَّ مَا يَدْعُونَ مِنْ دُونِهِ الْبَاطِلُ) - Allah-Təalanın bəhs olunan qüdrət və hikmətləri, hansı ki varlıqda elə qüdrət və hikmət sahibi başqa, yoxdur, o səbəbə görədir ki, Allah-Təalanın, həqiqətən, məbud** (ibadət edilən) **olması sabitdir və ondan başqa, müşriklərin ibadət edib Ona şərik saydığı bütlərin hamısı batildir. (وَاَنَّ اللّٰهَ هُوَ الْعَلِيُّ الْكَب۪يرُ) - Və həqiqətən, Allah-Təalanın şanı uca, hakimiyyəti böyükdür. Bütün hakimiyyətlər onun qüdrətinə tabedir.**

**31) (اَلَمْ تَرَ اَنَّ الْفُلْكَ تَجْر۪ي فِي الْبَحْرِ بِنِعْمَتِ اللّٰهِ لِيُرِيَكُمْ مِنْ اٰيَاتِه۪),-** (Ey Məhəmməd), **bəs baxıb görmürsən ki, Allah-Təalanın rəhməti sizə gəlib lütf və möcüzəsi ilə gəmilər dənizdə üzür. Ta ki öz qüdrətinə dəlil olan bəzi ayələri sizə göstərsin. Amma siz qəflətdən oyanmırsızmı. (اِنَّ ف۪ي ذٰلِكَ لَاٰيَاتٍ لِكُلِّ صَبَّارٍ شَكُورٍ) -Həqiqətən, bu bəhs edilən şeylərdə Allah-Təalanın tövhid və qüdrətinə dəlil və sübutlar vardır,** (dəlil və sübutu dərk etmək lazımdır).

**32) (وَاِذَا غَشِيَهُمْ مَوْجٌ كَالظُّلَلِ دَعَوُا اللّٰهَ مُخْلِص۪ينَ لَهُ الدّ۪ينَ) -** (Ey Məhəmməd), **o zaman ki dənizdə tufana düşüb uca kölgə salan dağlar kimi dalğalar onları yaxaladı, o vaxt Allah-Təlaya xalis imanla gizlincə dua, niyaz edib**

فَلَمَّا نَجّٰيهُمْ اِلَى الْبَرِّ فَمِنْهُمْ مُقْتَصِدٌ ۜ وَمَا يَجْحَدُ بِاٰيَاتِنَٓا اِلَّا كُلُّ خَتَّارٍ كَفُورٍ ﴿٣٢﴾ يَٓا اَيُّهَا النَّاسُ اتَّقُوا رَبَّكُمْ وَاخْشَوْا يَوْمًا لَا يَجْزِي وَالِدٌ عَنْ وَلَدِهٖۘ وَلَا مَوْلُودٌ هُوَ جَازٍ عَنْ وَالِدِهٖ شَيْـًٔاۜ اِنَّ وَعْدَ اللّٰهِ حَقٌّ فَلَا تَغُرَّنَّكُمُ الْحَيٰوةُ الدُّنْيَاٰ وَلَا يَغُرَّنَّكُمْ بِاللّٰهِ الْغَرُورُ ﴿٣٣﴾ اِنَّ اللّٰهَ عِنْدَهُ عِلْمُ السَّاعَةِۚ وَيُنَزِّلُ الْغَيْثَۚ

---

**Ona yönəlib, nicat istəyərlər. Allah-Təaladan başqasını unudarlar.** **(فَلَمَّا نَجّٰيهُمْ اِلَى الْبَرِّ فَمِنْهُمْ مُقْتَصِدٌ) - Elə ki Allah-Təala onların duasını qəbul edərək dənizdən onları xilas edib quruya çıxartdı,** (Ey Məhəmməd), **o vaxt baxıb görərsən ki, onların bəzisi ədalət, iman və ixlasını qoruyub saxlayar, qalan hamısı Allah-Təalanı unudub ayələri inkar edərlər.** **(وَمَا يَجْحَدُ بِاٰيَاتِنَٓا اِلَّا كُلُّ خَتَّارٍ كَفُورٍ) - Bizim tövhid və qüdrətimizə dəlil olan ayələri ancaq Allah-Təalaya kafir olan çox qəddar və hiyləgər şəxslər inkar edərlər.**

**33) (يَٓا اَيُّهَا النَّاسُ اتَّقُوا رَبَّكُمْ) - Ey insan nəsli, rəbbiniz Allah-Təaladan qorxub və günahı tərk edib, insanlıq sifətlərini, gözəl əxlaqı əldə edin.** **(وَاخْشَوْا يَوْمًا لَا يَجْزِي وَالِدٌ عَنْ وَلَدِهٖ) - Qorxun bir gündən** (qiyamət günündən) **ki, o gündə heç bir ata övladından ötrü bir çətinliyi həll edib ona bir çarə tapıb əzabdan onu xilas edə bilməz. (وَلَا مَوْلُودٌ هُوَ جَازٍ عَنْ وَالِدِهٖ شَيْـًٔا) - Və heç bir övlad da atasından ötrü bir çarə tapıb əzabı ondan dəf edə bilməz. Ogünkü gündə hər bir şəxsin əməlinin qarşılığı özünə çatar. (اِنَّ وَعْدَ اللّٰهِ حَقٌّ) - Həqiqətən, Allah-Təalanın vədi haqdır. Qiyamət günü vaqe olacaqdır. (فَلَا تَغُرَّنَّكُمُ الْحَيٰوةُ الدُّنْيَا) - Dünya həyatı sizi məğrur edib, aldadıb, Allah-Təaladan qafil olub günahı özünüzə şüar edib zalım olmayın. Siz fani olub dünya da yox olacaqdır. Ancaq çirkin əməllərinizin əzabının ağırlığı sizə qalacaqdır. (وَلَا يَغُرَّنَّكُمْ بِاللّٰهِ الْغَرُورُ) - Məğrur edən, aldadan şeytan** (şəri əmr edən nəfs) **sizi Allah-Təalaya qarşı məğrur edib, aldadıb, itaətdən çıxartmasın.** (Bir nəfər Bəni–Mühərib camaatından Allah Rəsulunun hüzuruna gəlib dedi ki, "Ey peyğəmbər, mənə qiyamətdən xəbər ver, nə vaxt vaqe olacaqdır? Bir də həyatımı davam etdirdiyim toxumu yerə saçmışam, göy yağışını bizdən saxlayıb, mənə xəbər ver, yağış nə vaxt yağacaq və arvadımdan mənə xəbər ver. Onun qarnındakı bala qızdır, ya oğlan? Dünənki hər bir əməlimdən xəbərdaram, sabahkı gün nə edəcəm? Mənə xəbər ver. Anadan olmağımı bilirəm, bəs ölüm nə zaman mənə gələcəkdir? Mənə xəbər ver". O vaxt bu mübarək ayə gəldi).

**34) (اِنَّ اللّٰهَ عِنْدَهُ عِلْمُ السَّاعَةِ) -** (Ey Məhəmməd), **həqiqətən, qiyamət gününün elmi Allah-Təala yanındadır və ona məxsusdur. Allah-Təaladan başqa heç bir şəxs ondan agah ola bilməz. (وَيُنَزِّلُ الْغَيْثَ) - Allah-Təala nə vaxt məsləhət görsə, yağış göndərər. Onun vaxtından xəbərdar olan olmaz.** (Bu ayə yağış barəsində münəccimlərin sözünün mənasızlığına dəlildir)**.**

وَيَعْلَمُ مَا فِي الْاَرْحَامِۜ وَمَا تَدْر۪ي نَفْسٌ مَاذَا تَكْسِبُ غَدًاۜ وَمَا تَدْر۪ي نَفْسٌ بِاَيِّ اَرْضٍ تَمُوتُۜ اِنَّ اللّٰهَ عَل۪يمٌ خَب۪يرٌ ﴿٣٤﴾

---

(وَيَعْلَمُ مَا فِي الْاَرْحَامِۜ) - **Anaların qarnındakı balaların oğlan, ya da qız olmasından Allah-Təala agahdır.** (وَمَا تَدْر۪ي نَفْسٌ مَاذَا تَكْسِبُ غَدًاۜ) - **Heç bir nəfs sabahkı gün onun əməlinin nə olacağını və nə edəcəyini bilməz. Allah-Təala isə agahdır.** (وَمَا تَدْر۪ي نَفْسٌ بِاَيِّ اَرْضٍ تَمُوتُ) - **və heç bir nəfs ölümün ona nə vaxt gəlib öləcəyini bilməz.** (Bu 5 şeyin elmi Allah-Təalaya məxsusdur. Allah-Təaladan başqa heç kim ona agah olmaz. Bunlara qeyb elmi deyilir). (اِنَّ اللّٰهَ عَل۪يمٌ خَب۪يرٌ) - **Həqiqətən, bu şeylərə və bunlardan başqa, hər bir şeyin zahir və batininə Allah-Təala agahdır.** (Allahın Rəsulu buyurdu: "Qeyb elminin açarı beşdir". Ondan sonra bu mübarək ayəni oxudu). **İbn Abbas buyurdu: "Kim ki bu bəhs edilən şeylərin elmini bildiyini iddia etsə, həqiqətən, o şəxs yalançıdır. Falçılıqdan kənar olun. Falçılıq Allah-Təalaya şirk qoşmağa yaxındır. Müşriklər cəhənnəm odunda qalacaqlar. Abbasi xəlifələrindən Mənsur öz ömür müddətinə agah olmaq fikrinə düşdü. Bir gecə yatıb yuxusunda gördü ki, guya dənizdən ona bir xəyal görünüb, əlini yuxarı qaldırıb 5 barmağı ilə Mənsura tərəf işarə etdi. Mənsur fəryad edərək yuxudan durub alimləri və yuxu yozanları çağırdı. Yuxusunu danışıb təbirini soruşdu. Biri 5 il, o biri 5 ay, digəri 5 həftə dedilər. Alimlərin arasındakı Əbu Hənifə dedi: "O beş barmaq mübarək ayədə bəhs olunan 5 qeyb elminə işarədir ki, onların elmi Allah-Təalaya məxsusdur". O cümlədən xəlifənin öz ömrünün müddətini bilmək istəməsi də buna aiddir. Xəlifə və alimlər bunu bəyəndilər, biz də elmdə geniş bilgi sahibi olduğu üçün Əbu Hənifənin anlayış qüdrətini bəyənirik. Allaha həmd olsun. Loğman surəsinin təfsiri tamam oldu. Nə gözəl nəsihət və vəsfləri ehtiva edən bir surədir.** (Söz eşidən qulaq hardadır, kimdə ibrət gözü var?) **Allahın Rəsulu buyurdular: "Kim Loğman surəsini oxusa,** (yəni o nəsihətləri qəbul etsə), **qiyamət günündə Loğman ona yoldaş olar".** ***(Zəmaxşəri, Kəşşaf, III/209)***

الٓمٓ ﴿١﴾ تَنْزِيلُ الْكِتَابِ لَا رَيْبَ فِيهِ مِنْ رَبِّ الْعَالَمِينَ ﴿٢﴾ اَمْ يَقُولُونَ افْتَرٰيهُ بَلْ هُوَ الْحَقُّ
مِنْ رَبِّكَ لِتُنْذِرَ قَوْمًا مَٓا اَتٰيهُمْ مِنْ نَذِيرٍ مِنْ قَبْلِكَ لَعَلَّهُمْ يَهْتَدُونَ ﴿٣﴾ اَللّٰهُ الَّذِي خَلَقَ السَّمٰوَاتِ
وَالْاَرْضَ وَمَا بَيْنَهُمَا فِي سِتَّةِ اَيَّامٍ

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (الٓمٓ) - bu mübarək surənin adıdır.**

**2) (تَنْزِيلُ الْكِتَابِ لَا رَيْبَ فِيهِ مِنْ رَبِّ الْعَالَمِينَ) - bu Qurani-Şərifin aləmlərə tərbiyə verən Allah-Təala tərəfindən göndərilməsinə heç bir şəkk və şübhə yoxdur.** (Yəni Qurani-Şərif layiq və münasib deyil ki, onun Allah-Təala tərəfindən olmağına şəkk və şübhə edilsin, ancaq Qurani-Şərifə şəkk edib inkar edənlər xeyli artıqdır. Lakin əgər insafla fikir versələr, nəinki inkar etmək, bəlkə onun Allah-Təala tərəfindən olmasına da şəkk edən olmaz. Amma inad və qohumbazlıq bir çox alim şəxsi zillətə salıb elmə əməl etməyiblər).

**3) (اَمْ يَقُولُونَ افْتَرٰيهُ) - Ya da ki bəlkə, müşriklər deyirlər:** (Məhəmməd) **bu Quranı özündən düzəldib yalandan Allah-Təalaya iftira atır? (بَلْ هُوَ الْحَقُّ مِنْ رَبِّكَ لِتُنْذِرَ قَوْمًا مَٓا اَتٰيهُمْ مِنْ نَذِيرٍ مِنْ قَبْلِكَ)** - (Ey Məhəmməd), **müşriklərin bu sözləri batildir, bəlkə, bu Quran haqdır, sənin rəbbin Allah-Təaladan sənə gəlib ki, bu Quran"la elə bir camaatı** (Qüreyş camaatını) **qorxudasan ki, səndən əvvəl onlara bir qorxudan** (peyğəmbər) **gəlməyibdir.** (Bu mübarək ayə Məkkə əhli olan Qüreyş camaatına məxsusdur, Allahın Rəsulu Məhəmməd ibn Abdullahdan başqa onlara peyğəmbər göndərilməmişdir). **(لَعَلَّهُمْ يَهْتَدُونَ) -** (Ey Məhəmməd), **onları dəvət edib qorxutmaqla ümid et ki, bəlkə, hidayət tapıb Haqq tərəfinə dönələr.**

*(*Qeyd: "Sual: "Peyğəmbər göndərilməyən bir camaata Allah-Təala əzab edər, ya yox? Cavab: "Peyğəmbərin gəlib bəyan etməməsi ilə o hökmlər (cüzi hökmlər və ehkamın səbəbləri) ki, onlara məlum olmaz, onlardan ötrü peyğəmbər gəlməyən vaxtda Allah-Təala onlara əzab etməz, bəlkə, əzab etməsi də doğru deyil. Amma o hökmlər (tövhid və ilahi bilgi) ki, ağılla bilinə və peyğəmbərə ehtiyac yoxdur, onlara əzab edər, peyğəmbərin gəlib gəlməməsinin fərqi yoxdur).*

**4) (اَللّٰهُ الَّذِي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَا فِي سِتَّةِ اَيَّامٍ) - Allah-Təala öz kamil**

ثُمَّ اسْتَوٰى عَلَى الْعَرْشِۜ مَا لَكُمْ مِنْ دُونِهٖ مِنْ وَلِيٍّ وَلَا شَفٖيعٍۜ اَفَلَا تَتَذَكَّرُونَ ﴿٤﴾ يُدَبِّرُ الْاَمْرَ
مِنَ السَّمَٓاءِ اِلَى الْاَرْضِ ثُمَّ يَعْرُجُ اِلَيْهِ فٖي يَوْمٍ كَانَ مِقْدَارُهُٓ اَلْفَ سَنَةٍ مِمَّا تَعُدُّونَ ﴿٥﴾ ذٰلِكَ عَالِمُ
الْغَيْبِ وَالشَّهَادَةِ الْعَزٖيزُ الرَّحٖيمُۙ ﴿٦﴾ اَلَّذٖٓي اَحْسَنَ كُلَّ شَيْءٍ خَلَقَهُ وَبَدَاَ خَلْقَ الْاِنْسَانِ مِنْ طٖينٍۚ
﴿٧﴾ ثُمَّ جَعَلَ نَسْلَهُ مِنْ سُلَالَةٍ مِنْ مَٓاءٍ مَهٖينٍۚ ﴿٨﴾

---

**qüdrəti ilə göyləri və yeri, onların arasındakı məxluqatı 6 gündə yaratdı.** (6 gün bizdə təsəvvür yaratmaqdan ötrüdür, yoxsa Allah-Təalanın işləri vaxt və zamandan uzaqdır). (ثُمَّ اسْتَوٰى عَلَى الْعَرْشِ) **- Ondan sonra məxluqata hakim oldu.** (Bu mətləb daha əvvəl tədqiq edildi).

(مَا لَكُمْ مِنْ دُونِهٖ مِنْ وَلِيٍّ وَلَا شَفٖيعٍ اَفَلَا تَتَذَكَّرُونَ) **- O zaman ki siz Allah-Təalanın məmnunluğunu pozub onun itaətindən çıxdınız, sizdən ötrü Allah-Təaladan başqa nə bir kömək edən, nə də bir şəfaət edən tapa bilməyəcəksiniz. Bəs fikir verib xatırlamazsınız ki, Allah-Təala sizə kömək etməyəndə kim sizə kömək olacaqdır?**

**5)** (يُدَبِّرُ الْاَمْرَ مِنَ السَّمَٓاءِ اِلَى الْاَرْضِ) **- Allah-Təala siz insan nəslindən ötrü hər bir işin tədbirini edib göydən** (uca məqamdan) **yer üzünə endirər. Amma siz Allah-Təalanın əmrlərinə itaət etməyib ona asi olursunuz.** (ثُمَّ يَعْرُجُ اِلَيْهِ فٖي يَوْمٍ كَانَ مِقْدَارُهُٓ اَلْفَ سَنَةٍ مِمَّا تَعُدُّونَ) **- Ondan sonra hər bir işi ki, siz etdiniz və ya etmədiniz, Allah-Təala tərəfinə qayıdıb lövhi-məhfuzda** (ilahi elmdə) **sizdən ötrü qeyd olunar. Elə bir gündə ki, o günün miqdarı siz sayan günlərdən min il qədərdir. O işlərin barəsində Allah-Təala sizin aranızda hökm edib hər bir şəxsin əməlinin cəzasını ona versin.**

**6)** (ذٰلِكَ عَالِمُ الْغَيْبِ وَالشَّهَادَةِ الْعَزٖيزُ الرَّحٖيمُ) **- Göyləri və yeri yaradıb xalqın əməllərini mühafizə edən belə sifətlərin sahibi məxluqata qalib olub, düşmənindən intiqam alıb, dostlarına rəhm edən, zahir və qeybə agah olan Allah-Təaladır.**

**7)** (اَلَّذٖٓي اَحْسَنَ كُلَّ شَيْءٍ خَلَقَهُ) **- Allah-Təalanın sifətlərindən biri odur ki, hər bir şeyi ki, yaradıb onun yaradılışını hikmət və fayda ilə, gözəl şəkildə təyin edibdir.** (Allah-Təalanın bütün məxluqatı gözəldir, fərq gözəl və ya daha gözəl olmasındadır. Bir də gözəl olmaqdan məqsəd onun növünə görədir. Məsələn, insan, at, eşşək, dəvə və s. heyvanlarda bəzi çirkinliklər olsa da, insan, at, hər bir növ özünə görə gözəl məxluqdur). (وَبَدَاَ خَلْقَ الْاِنْسَانِ مِنْ طٖينٍ) **- Baxıb görək, Allah-Təala hansı şeylərdən necə gözəl məxluqat yaradıbdır. İnsanın** (Adəmin) **yaradılışı hər bir şeydən əskik olan palçıqdan başlayıb.** (Belə gözəl surətdəki insanın palçıqla nə əlaqəsi vardır? Bu yaradılış Allah-Təalanın qüdrətinə böyük dəlil deyilmi?)

**8)** (ثُمَّ جَعَلَ نَسْلَهُ مِنْ سُلَالَةٍ مِنْ مَٓاءٍ مَهٖينٍ) **- Adəmi palçıqdan yaradandan sonra onun övladını atadan süzülən bir miqdar az sudan** (sperma) **təyin edib yaratdı.**

ثُمَّ سَوّٰيهُ وَنَفَخَ فٖيهِ مِنْ رُوحِهٖ وَجَعَلَ لَكُمُ السَّمْعَ وَالْاَبْصَارَ وَالْاَفْئِدَةَۜ قَلٖيلًا مَا تَشْكُرُونَ ﴿٩﴾ وَقَالُٓوا
ءَاِذَا ضَلَلْنَا فِي الْاَرْضِ ءَاِنَّا لَفٖي خَلْقٍ جَدٖيدٍۜ بَلْ هُمْ بِلِقَٓاءِ رَبِّهِمْ كَافِرُونَ ﴿١٠﴾ قُلْ يَتَوَفّٰيكُمْ مَلَكُ
الْمَوْتِ الَّذٖي وُكِّلَ بِكُمْ ثُمَّ اِلٰى رَبِّكُمْ تُرْجَعُونَ ۟ ﴿١١﴾ وَلَوْ تَرٰٓى اِذِ الْمُجْرِمُونَ نَاكِسُوا رُؤُ۫سِهِمْ عِنْدَ
رَبِّهِمْۜ رَبَّنَٓا اَبْصَرْنَا وَسَمِعْنَا فَارْجِعْنَا نَعْمَلْ صَالِحًا اِنَّا مُوقِنُونَ ﴿١٢﴾ وَلَوْ شِئْنَا لَاٰتَيْنَا كُلَّ نَفْسٍ هُدٰيهَا

---

**9) (ثُمَّ سَوّٰيهُ وَنَفَخَ فٖيهِ مِنْ رُوحِهٖ) - Ondan sonra hәmin spermanı ananın bәtnindә düzәldib insan surәtinә daxil edib öz ruhundan ona üflәyib, hәyat tapıb insan oldu. (وَجَعَلَ لَكُمُ السَّمْعَ وَالْاَبْصَارَ وَالْاَفْئِدَةَ) - Allah-Tәala sizi ana bәtnindә insan surәtinә daxil edib sizdәn ötrü qulaqlar, gözlәr, qәlblәr tәyin edibdir. Belә ki, onlarla hәr bir şeyi dәrk edәsiniz. (قَلٖيلًا مَا تَشْكُرُونَ) - Amma siz insan nәsli bu nemәtlәrin sahibi olan Allah-Tәalaya çox az vaxt şükür edirsiniz, halbuki belә Allah-Tәalaya gәrәk hәmişә şükür edib heç vaxt nemәtә nankor olmayasınız.**

**10) (وَقَالُٓوا ءَاِذَا ضَلَلْنَا فِي الْاَرْضِ ءَاِنَّا لَفٖي خَلْقٍ جَدٖيدٍ) - Qiyamәti inkar edәnlәr dedilәr: "Heç mümkündür ki, o zaman ki ölüm bizә gәlib, dünyadan gedib, yerin altında qeyb olub, bәdәnimiz torpağa dönüb, yerin torpağına qarışar vә o vaxt tәzәdәn canlı olub dirilәk, bu, heç mümkün olan iş deyil". (بَلْ هُمْ بِلِقَٓاءِ رَبِّهِمْ كَافِرُونَ) -** (Ey Mәhәmmәd), **bәlkә bu müşriklәr birdәfәlik Allah-Tәalanın rәhmәt vә qәzәbi ilә qarşılaşmağı inkar edib kafir olurlar?**

**11) (قُلْ يَتَوَفّٰيكُمْ مَلَكُ الْمَوْتِ الَّذٖي وُكِّلَ بِكُمْ) - Müşriklәrә de ki,** (Ey Mәhәmmәd), **belә deyildi ki, siz deyirsiniz ki, bәlkә, o ölüm mәlәyi ki, sizin üçün tәyin olunub** (sizin batininizdәki ünsürlәrin ixtilafı sәbәbi ilә vәd edilib). **Dәrhal o sizi vәfat etdirib, mәhv etdirәcәkdir. Bir iş ki, sizin batininizdә olsun, ondan qaçıb xilas olmaq sizdәn ötrü imkansızdır. (ثُمَّ اِلٰى رَبِّكُمْ تُرْجَعُونَ) - Ölüm bir kәsin әmrdir, sizә gәlәndәn sonra mütlәq rәbbiniz Allah-Tәala tәrәfinә qayıdıb, o vaxtda әmәllәrinizin qarşılığı sizә verilәcәkdir. Siz qәbul edin, ya etmәyin, bu әmr vaqe olacaqdır.**

**12) (وَلَوْ تَرٰٓى اِذِ الْمُجْرِمُونَ نَاكِسُوا رُؤُ۫سِهِمْ عِنْدَ رَبِّهِمْ) -** (Ey Mәhәmmәd), **qiyamәt günündә kaş görәsәn ki, o zaman müşriklәr vә günahkarlar rәblәri Allah-Tәalanın hüzurunda durub hәya vә xәcalәtdәn başlarını aşağı salıblar, mütlәq o vaxt onları bir yaman halda görәrsәn. (رَبَّنَٓا اَبْصَرْنَا وَسَمِعْنَا) - O vaxt deyәrlәr: "Ey bizim rәbbimiz, dünyada verdiyin vәdlәrin doğruluğunu indi gördük vә peyğәmbәrlәrin tәsdiq olunduğunu sәndәn eşitdik.**

**(فَارْجِعْنَا نَعْمَلْ صَالِحًا اِنَّا مُوقِنُونَ) - Bizi qaytar dünyaya ki, orada xeyir әmәllәr edәk, hәqiqәtәn, indi biz mütlәq olaraq iman etmişik.** (Müşriklәr vә asilәr qiyamәt günündә iman edәrlәr, lakin o iman onlara fayda vermәz).

**13) (وَلَوْ شِئْنَا لَاٰتَيْنَا كُلَّ نَفْسٍ هُدٰيهَا) -** (Ey Mәhәmmәd), **әgәr biz istәsәk, zorla**

وَلٰكِنْ حَقَّ الْقَوْلُ مِنّي لَاَمْلَئَنَّ جَهَنَّمَ مِنَ الْجِنَّةِ وَالنَّاسِ اَجْمَعٖينَ ﴿١٣﴾ فَذُوقُوا بِمَا نَسٖيتُمْ لِقَٓاءَ يَوْمِكُمْ هٰذَاۚ اِنَّا نَسٖينَاكُمْ وَذُوقُوا عَذَابَ الْخُلْدِ بِمَا كُنْتُمْ تَعْمَلُونَ ﴿١٤﴾ اِنَّمَا يُؤْمِنُ بِاٰيَاتِنَا الَّذٖينَ اِذَا ذُكِّرُوا بِهَا خَرُّوا سُجَّدًا وَسَبَّحُوا بِحَمْدِ رَبِّهِمْ وَهُمْ لَا يَسْتَكْبِرُونَ﴿١٥﴾ تَتَجَافٰى جُنُوبُهُمْ عَنِ الْمَضَاجِعِ يَدْعُونَ رَبَّهُمْ خَوْفًا وَطَمَعًاۘ وَمِمَّا رَزَقْنَاهُمْ يُنْفِقُونَ ﴿١٦﴾ فَلَا تَعْلَمُ نَفْسٌ مَٓا اُخْفِيَ لَهُمْ مِنْ قُرَّةِ اَعْيُنٍۚ جَزَٓاءً بِمَا كَانُوا يَعْمَلُونَ﴿١٧﴾

---

**və məcburən hər bir nəfsə hidayət verib islam dininə daxil edərik, amma biz insana iradə vermişik, məcburiyyət yox, hər bir şəxs küfr və ya imanı seçməkdə azaddır. (**وَلٰكِنْ حَقَّ الْقَوْلُ مِنّي لَاَمْلَئَنَّ جَهَنَّمَ مِنَ الْجِنَّةِ وَالنَّاسِ اَجْمَعٖينَ**) - Lakin asilər küfrü hidayətə üstün saydıqlarına görə, mənim tərəfimdən sözüm** (əmrim) **haqq və sabit olub, gərək, cəhənnəmi cin və insan kafirləri ilə doldurum.**

**14) (**فَذُوقُوا بِمَا نَسٖيتُمْ لِقَٓاءَ يَوْمِكُمْ هٰذَاۚ اِنَّا نَسٖينَاكُمْ**) - Qiyamət günündə müşrik və asilərə deyərlər, dünyada bu gününüzlə qarşılaşmağınızı unutduğunuz üçün bu gün cəhənnəm əzabını dadın. Həqiqətən, o unutmanın əvəzində biz də sizi unutmuşuq, ona görə də sizə əzab olunur, (**وَذُوقُوا عَذَابَ الْخُلْدِ بِمَا كُنْتُمْ تَعْمَلُونَ**) dünyada etdiyiniz küfr və günahlar səbəbinə həmişəlik əzabı dadıb cəhənnəmdə əbədi qalın.**

**15) (**اِنَّمَا يُؤْمِنُ بِاٰيَاتِنَا الَّذٖينَ اِذَا ذُكِّرُوا بِهَا خَرُّوا سُجَّدًا وَسَبَّحُوا بِحَمْدِ رَبِّهِمْ وَهُمْ لَا يَسْتَكْبِرُونَ**)** - (Ey Məhəmməd), **həqiqətən, bizim ayələrimiz onlara oxunduğu zaman o şəxslər iman edir. Allah-Təalaya təvazökarlıq edib islam dininə şükür etməkdən ötrü səcdə edərək həmd-səna edib hər bir eyib və nöqsandan Allah-Təalanı pak və müqəddəs sayırlar və Allah-Təalaya səcdə edib həmd-səna etmələri səbəbi ilə təkəbbürlənməzlər.**

**16) (**تَتَجَافٰى جُنُوبُهُمْ عَنِ الْمَضَاجِعِ**) - Möminlərin sifətlərindən biri odur ki, gecə vaxtlarında onların qabırğaları yatdıqları yerdən** (istirahət yeri) **aralanıb, durub Allah-Təalaya ibadət edərlər. (**يَدْعُونَ رَبَّهُمْ خَوْفًا وَطَمَعًاۘ**) Rəbləri Allah-Təalanın qəzəbindən qorxub, rəhmətini arzu edib, ona dua edib, ibadət edərlər. (**وَمِمَّا رَزَقْنَاهُمْ يُنْفِقُونَ**) - Və onlara ruzi verdiyimiz nemətlərdən xərcləyib ümmətin övladlarına kömək olub onların ehtiyaclarını görürlər.**

**17) (**فَلَا تَعْلَمُ نَفْسٌ مَٓا اُخْفِيَ لَهُمْ مِنْ قُرَّةِ اَعْيُنٍۚ جَزَٓاءً بِمَا كَانُوا يَعْمَلُونَ**) - Allah-Təala axirətdə möminlərin əməllərinin qarşılığında onların gözlərini nurlandıran nemətlər saxlayıb və onlardan ötrü hazır edibdir, heç bir nəfs onlardan agah deyil.** (Bu iki mübarək ayə möminlərin sifətlərini-gecə namaz qılmaq və ümmətin övladları yolunda mallarını xərcləmək fəzilətini bəyan edir. Heyif, bizim islam ümməti bu mübarək ayənin məzmununu təfsir etməyib, gündəlik namazların əksəriyyətini tərk edib, qarşılıqsız mal vermək əvəzinə

depolarda mal yığmaqla Qarunu təqlid ediblər. İlahi xeyirdən faydalanmaq üçün bir hədisi bu məqamda deyək, amma hədisin axırına, gərək, dürüst diqqət edilsin. (Muaz ibn Cəbəl) rəvayət edib deyir ki, bir səfərdə Allahın Rəsulu ilə birlikdə idim. Bir gün sabah vaxtı yol əsnasında Allahın Rəsuluna yaxınlaşdım. Dedim: "Ey Peyğəmbər, mənə elə bir əməl xəbər ver ki, məni cəhənnəm odundan kənar edib cənnətə daxil etsin". Allahın Rəsulu (sav) buyurdu: "Çətin sual verdin, amma Allah-Təala bir şəxsdən ötrü bunu asan etsə, asan olar. (Ey Muaz), Allah-Təalaya ibadət edib heç bir şeyi ona şərik qoşma, namaz qıl, zəkat ver, Ramazan ayında oruc tut, həccə get, ondan sonra buyurdu: (Ey Muaz), xəbərdar ol ki, sənə xeyir qapısını işarə etdim. Oruc insanı Allah-Təalanın əzabından qorumaqdan ötrü bir dəri kimidir. Sədəqə vermək xəta və günahların cəhənnəmdəki odunu söndürər, bir də insanın gecə içində namaz qılması". Ondan sonra bu ayəni oxudu:"İbadət etdikləri üçün vücudları yataqdan uzaq qalar". Ondan sonra buyurdu: "(ey Muaz), istəyirsən sənə xəbər verim, hər bir işin başı islam dini üzrə (müvəhhid) olmaqdır. Dinin sütunu namazdır. Dinin zirvəsi cihad etməkdir". Ondan sonra buyurdu: "(ey Muaz), istəyirsən, sənə bunların hamısını ehtiva edən bir şey deyim". Dedim ki, bəli, ey peyğəmbər. O cənab mübarək dilini göstərib buyurdu: "Bu dilini qoru, dedim ki, ey peyğəmbər, bəs bizim danışdığımız sözlərdən Allah-Təala bizi sorğu-sual edəcəkmi?" Buyurdu: "Anan yasına gəlsin, ey Muaz. Bəs xalqı öz dilindən çıxan sözlər səbəbi ilə cəhənnəm oduna salan başqa bir şey varmı?" Bu hədisi-şərifin, xüsusən, axırına dürüst fikir verilib təfəkkür edilsin ki, o ulu şəxs əsl məramını bəyan edərkən öncə bir giriş edib sonra tədricən məqsədinə çatdı. Dil qəlbin tərcümanı olub xeyir və şər, küfr və iman, təlim və təfəkkürdə elmin aləti olduğuna görə, onu islam dinindəki bütün əmrlərin ehtivaedicisi elan etdi və həqiqətən də belədir və heç bir ədib və müdrik şəxsə uca peyğəmbərimizin belə möcüzəli kəlmələrinin məqsədinin nə olması gizli deyildir. O cənabın belə həqiqi gövhər olan kəlmələri biz islam ümməti arasından hara gedib, necə olub ki, qeyb olub, çox təəccüblü məqamdır. Hidayət verən Allahdır).

**18) (اَفَمَنْ كَانَ مُؤْمِنًا كَمَنْ كَانَ فَاسِقًاۜ لَا يَسْتَوُنَ) - Əllamə Xazin (Əli ibn İbrahim) Bağdadi öz təfsiri "Lübabut-təvil fi məanit-tənzil" də qeyd edib deyir: "Bu mübarək ayə Əli ibn Əbu Talib və Vəlid ibn Uqbə haqqında gəlibdir. Allah-Təala bu ayədə Əliyə mömin, Vəlidə fasiq** (Allah düşməni) **deyir. Onların arasında bir məsələ danışılarkən, Vəlid Əli ibn Əbu Talibə dedi: "Sakit ol, sən uşaqsan, mən qocayam. Hər bir məqamda mən səndən üstünəm". Əli dedi: "Sən sakit ol, həqiqətdə, sən fasiqsən". O vaxt bu mübarək ayə gəldi. Ayənin mənası belədir. Buyurur: "Bəs o şəxs ki Allah-**

اَمَّا الَّذٖينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ فَلَهُمْ جَنَّاتُ الْمَاْوٰىۘ نُزُلًا بِمَا كَانُوا يَعْمَلُونَ ﴿١٩﴾ وَاَمَّا الَّذٖينَ فَسَقُوا فَمَاْوٰيهُمُ النَّارُۘ كُلَّمَٓا اَرَادُوٓا اَنْ يَخْرُجُوا مِنْهَٓا اُعٖيدُوا فٖيهَا وَقٖيلَ لَهُمْ ذُوقُوا عَذَابَ النَّارِ الَّذٖي كُنْتُمْ بِهٖ تُكَذِّبُونَ﴿٢٠﴾ وَلَنُذٖيقَنَّهُمْ مِنَ الْعَذَابِ الْاَدْنٰى دُونَ الْعَذَابِ الْاَكْبَرِ لَعَلَّهُمْ يَرْجِعُونَ﴿٢١﴾ وَمَنْ اَظْلَمُ مِمَّنْ ذُكِّرَ بِاٰيَاتِ رَبِّهٖ ثُمَّ اَعْرَضَ عَنْهَاۜ اِنَّا مِنَ الْمُجْرِمٖينَ مُنْتَقِمُونَ۟ ﴿٢٢﴾ وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْكِتَابَ فَلَا تَكُنْ فٖي مِرْيَةٍ مِنْ لِقَٓائِهٖ وَجَعَلْنَاهُ هُدًى لِبَنٖيٓ اِسْرَٓائٖيلَۚ ﴿٢٣﴾

---

**Təala və onun peyğəmbərinə** (Məhəmmədə) **iman edir, o şəxs kimidir ki, fasiq olub? Heç vaxt mömin fasiqlə eyni və bərabər ola bilməz.** (Amma bu mübarək ayə Əli və Vəlid haqqında gəlmiş olsa da, hökmü ümumidir). **Növbəti ayələrdə möminlə fasiqin axirətdəki dərəcə fərqi göstərilir.**

**19) (اَمَّا الَّذٖينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ) - Amma o şəxslər ki, Allah-Təala və onun peyğəmbəri** (Məhəmmədə) **iman edib, xeyir əməl edir, (فَلَهُمْ جَنَّاتُ الْمَاْوٰىۘ نُزُلًا بِمَا كَانُوا يَعْمَلُونَ) onlardan ötrü istirahət bağları (cənnətin bir yeri) tədarük edilib hazırlanmışdır.** (O bağlardan başqa da onlardan ötrü əlavə məqamlar hazır edilibdir).

**20) (وَاَمَّا الَّذٖينَ فَسَقُوا فَمَاْوٰيهُمُ النَّارُ) - Amma fasiq şəxslərin yurd və məkanları axirətdə cəhənnəmin odudur. (كُلَّمَٓا اَرَادُوٓا اَنْ يَخْرُجُوا مِنْهَٓا اُعٖيدُوا فٖيهَا) - Hər zaman ki istəyərlər ki, cəhənnəm əzabından xilas olsunlar, Allah-Təala tərəfindən onları əzab tərəfinə qaytarıb əzabda qalarlar.**

**(وَقٖيلَ لَهُمْ ذُوقُوا عَذَابَ النَّارِ الَّذٖي كُنْتُمْ بِهٖ تُكَذِّبُونَ) - Onlar əzab tərəfinə qaytarılıb onlara deyilər ki, dadın bir odun əzabını ki, dünyada onu təkzib edirdiniz.**

**21) (وَلَنُذٖيقَنَّهُمْ مِنَ الْعَذَابِ الْاَدْنٰى دُونَ الْعَذَابِ الْاَكْبَرِ لَعَلَّهُمْ يَرْجِعُونَ) -** (Ey Məhəmməd), **sənə kafir olan Məkkə əhlinə dünya əzabını** (Məkkədə qıtlıq olub Bədir davasında öldürülmək və əsir olmaq) **axirət əzabından öncə dadın, deyərik. Bəlkə, küfr və şirkdən tövbə edib Allah-Təala tərəfinə qayıdalar).**

**22) (وَمَنْ اَظْلَمُ مِمَّنْ ذُكِّرَ بِاٰيَاتِ رَبِّهٖ ثُمَّ اَعْرَضَ عَنْهَاۜ) - Kimdir daha zalım o şəxsdən ki, Allah-Təalanın ayələri ona deyilib dərk edəndən sonra ondan üz çevirsin?** (Gərək Allah-Təalanın ayələrinə dürüst diqqət edib iman etmək, nəinki uzaq çevirmək). **(اِنَّا مِنَ الْمُجْرِمٖينَ مُنْتَقِمُونَ)** - (Ey Məhəmməd), **həqiqətən, biz kafir və asilərdən intiqam alanıq.**

**23-24) (وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْكِتَابَ فَلَا تَكُنْ فٖي مِرْيَةٍ مِنْ لِقَٓائِهٖ)** - (Ey Məhəmməd), **həqiqətən Musaya kitab verdik, sənə verən kitab da Musanın kitabının oxşarıdır. Musaya kitab və vəhy göndərən kimi sənə də vəhy göndərdik. Musanın kitabının oxşarı ilə və ona göndərilən vəhyin bənzəri ilə qarşılaşmaqdan şəkk-şübhə etmə. (وَجَعَلْنَاهُ هُدًى لِبَنٖيٓ اِسْرَٓائٖيلَ) - Musaya verdiyimiz ki-**

وَجَعَلْنَا مِنْهُمْ اَئِمَّةً يَهْدُونَ بِاَمْرِنَا لَمَّا صَبَرُوا وَكَانُوا بِاٰيَاتِنَا يُوقِنُونَ ﴿٢٤﴾ اِنَّ رَبَّكَ هُوَ يَفْصِلُ بَيْنَهُمْ
يَوْمَ الْقِيٰمَةِ فِيمَا كَانُوا فِيهِ يَخْتَلِفُونَ﴿٢٥﴾ اَوَلَمْ يَهْدِ لَهُمْ كَمْ اَهْلَكْنَا مِنْ قَبْلِهِمْ مِنَ الْقُرُونِ يَمْشُونَ
فِي مَسَاكِنِهِمْ اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ اَفَلَا يَسْمَعُونَ ﴿٢٦﴾ اَوَلَمْ يَرَوْا اَنَّا نَسُوقُ الْمَاۤءَ اِلَى الْاَرْضِ
الْجُرُزِ فَنُخْرِجُ بِهٖ زَرْعًا تَاْكُلُ مِنْهُ اَنْعَامُهُمْ وَاَنْفُسُهُمْ

---

**tabı Bәni-İsraildәn ötrü hidayәtedici tәyin etdik.** (Habelә Quranı da Tövrat kimi hidayәt verәn tәyin etdik).

(وَجَعَلْنَا مِنْهُمْ اَئِمَّةً يَهْدُونَ بِاَمْرِنَا لَمَّا صَبَرُوا وَكَانُوا بِاٰيَاتِنَا يُوقِنُونَ) **- O zaman ki Bәni-İsrail bizim ayәlәrimizә iman edib, dindә hәr bir bәlaya sәbir etdilәr, ona görә onları din işlәrindә rәhbәr tәyin etdik. Belә ki, xalqı bizim itaәtimizә vә Tövrata әmәl etmәyә dәvәt etsinlәr. İlahi, sәn özün agahsan ki, bu zamanda elә şәxslәrә küfr vә zındıqlıq nisbәt edib haqq sözü onlardan qәbul etmirlәr. Zahirdә özlәrini ümmәt vә mәzhәb rәisi hesab edib, әslindә, din vә mәzhәbi pozanlar meydana gәlib onların tәqsirindәn islam dini zay olubdur. Bugünkü gündә islam dininin zәiflәmәsi vә pәrişan olması bu mәtlәbә günәş kimi aşkar dәlildir. Bir din vә mәzhәb ki, onların bir bölgәdә olan 5 nәfәr rәisindәn hәr biri özündәn başqasını alim vә tәqlid edilmәyә layiq saymayıb özünü uca peyğәmbәrin xas elçisi saya, halbuki Allah Rәsulundan onlarda heç bir nişan vә әlamәt yoxdur, o din vә mәzhәbdәn nә ümid etmәk olar, belә ki, dini pozan rәislәrin kökü islam ümmәti arasından qoparılmaya, o islam ümmәti heç vaxt aydınlığa çıxmaz.**

**25-26)** (اِنَّ رَبَّكَ هُوَ يَفْصِلُ بَيْنَهُمْ يَوْمَ الْقِيٰمَةِ فِيمَا كَانُوا فِيهِ يَخْتَلِفُونَ) - (Ey Mәhәmmәd), **hәqiqәtәn, sәnin rәbbin Allah-Tәala özü qiyamәt günündә din vә mәzhәbdә ixtilaf salanların arasında hökm edib asilәrә әzab edәr.**

(اَوَلَمْ يَهْدِ لَهُمْ كَمْ اَهْلَكْنَا مِنْ قَبْلِهِمْ مِنَ الْقُرُونِ يَمْشُونَ فِي مَسَاكِنِهِمْ) - (Ey Mәhәmmәd), **Mәkkә әhli - onlardan әvvәl yaşayan ümmәtlәrdәn bizә asi olan nә qәdәr insanı hәlak etdiyimizi öz sәfәrlәrindә onların diyarlarına gedәrәk izlәrini görürlәr, amma bizim qüdrәtimiz onları hidayәt etdirmir? Belә ki, onlardan ibrәt alıb Quran ayәlәrinә iman etsinlәr.**

(اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ اَفَلَا يَسْمَعُونَ) **- Hәqiqәtәn, o ümmәtlәrin** (mәsәlәn, Ad, Sәmud camaatı) **hәlak olmasında Allah-Tәalanın tövhid vә qüdrәtinә dәlil vә sübutlar vardır. Bәs niyә müşriklәr Allah-Tәalanın ayә vә ehkamlarını eşidib nәsihәti qәbul etmirlәr?**

**27)** (اَوَلَمْ يَرَوْا اَنَّا نَسُوقُ الْمَاۤءَ اِلَى الْاَرْضِ الْجُرُزِ) - (Ey Mәhәmmәd), **bәs baxıb görmürlәr ki, biz öz qüdrәtimizlә yağışın suyunu aparırıq elә bir yerә ki, orada nәbatatdan heç bir şey olmasın.** (فَنُخْرِجُ بِهٖ زَرْعًا تَاْكُلُ مِنْهُ اَنْعَامُهُمْ وَاَنْفُسُهُمْ) **- O suyun sәbәbinә onların әkdiyi toxumları göyәrtdik. Belә ki, ondan hәm**

اَفَلَا يُبْصِرُونَ ﴿٢٧﴾ وَيَقُولُونَ مَتٰى هٰذَا الْفَتْحُ اِنْ كُنْتُمْ صَادِقِينَ ﴿٢٨﴾ قُلْ يَوْمَ الْفَتْحِ لَا يَنْفَعُ
الَّذِينَ كَفَرُوٓا اِيمَانُهُمْ وَلَا هُمْ يُنْظَرُونَ ﴿٢٩﴾ فَاَعْرِضْ عَنْهُمْ وَانْتَظِرْ اِنَّهُمْ مُنْتَظِرُونَ ﴿٣٠﴾

---

**heyvanları, həm də özləri yesinlər. (اَفَلَا يُبْصِرُونَ) Bəs bu şeyləri görmürlər? Ta ki, Allah-Təalanın tövhid və qüdrətinə tabe olsunlar.**

**28) (وَيَقُولُونَ مَتٰى هٰذَا الْفَتْحُ اِنْ كُنْتُمْ صَادِقِينَ) -** (Möminlər müşriklərə deyirdilər: “Elə bir gün olacaq ki, Allah-Təala bizim ilə sizin aranızda hökm edib bizi sizə qalib edəcək”. Müşriklərin cavabını Allah-Təala ayədə xəbər verib buyurur). **Müşriklər onların cavabında deyirdilər: “Fəth günü nə zaman olacaq? Əgər doğru deyirsinizsə, bizdən ötrü o günü bəyan edin”.** (Növbəti ayədə Allah-Təala onların cavabını verir).

**29) (قُلْ يَوْمَ الْفَتْحِ لَا يَنْفَعُ الَّذِينَ كَفَرُوٓا اِيمَانُهُمْ وَلَا هُمْ يُنْظَرُونَ)** - (Ey Məhəmməd), **müşriklərə de ki, fəth və qələbə gününü istəməkdə tələsib istehza etdiyinizi görürəm. Siz o gündə hazır olub qorxudan iman edəcəksiniz, amma ogünkü gündə sizin kimi kafirlərə imanları mənfəət verməz və əzabdan möhlət istəsələr, onlara möhlət də verilməyəcək.**

**30) (فَاَعْرِضْ عَنْهُمْ) -** (Ey Məhəmməd), **müşriklərdən üz çevirib onlarla din məsələsini də heç danışma. Onlar imana gələn deyillər. (وَانْتَظِرْ اِنَّهُمْ مُنْتَظِرُونَ) - Mən ki sənə vəd etmişəm, səni onlara qalib edəcəyəm. Mənim vədimi gözlə. Onlar da gözləyirlər. Belə ki, sənə qalib gəlib səni həlak etsinlər. Görək hansı biri vaqe olacaq?** (Allah-Təalanın vədi vaqe olub Bədir savaşında müşriklər öldürülüb, əsir edilib, uca peyğəmbərimiz onlara qalib gəldi).

**Allaha həmd olsun, Səcdə surəsinin təfsiri tamam oldu. Nə gözəl ibrət verən ayələri ehtiva edən bir surədir. Gərək hər bir ayənin mənasına diqqətlə baxıb ibrət alınsın. Allahın Rəsulu buyurdu: “Hər şəxs ki bu Səcdə surəsini oxusa** (yəni məzmunundan ibrət alsa), **Allah-Təala ona qədir gecəsini ibadətlə keçirənin mükafatı qədər savab bəxş edər”.**

## əl-ƏHZAB SURƏSİ

33-cü surədir. Mədinədə nazil olub, 73 ayə, 1280 kəlmə və 5790 hərfdir.

يَآ اَيُّهَا النَّبِيُّ اتَّقِ اللّٰهَ وَلَا تُطِعِ الْكَافِرِينَ وَالْمُنَافِقِينَ ۜ اِنَّ اللّٰهَ كَانَ عَلِيمًا حَكِيمًاۙ ﴿١﴾ وَاتَّبِعْ مَا
يُوحٰٓى اِلَيْكَ مِنْ رَبِّكَ ۜ اِنَّ اللّٰهَ كَانَ بِمَا تَعْمَلُونَ خَبِيرًاۙ ﴿٢﴾ وَتَوَكَّلْ عَلَى اللّٰهِ ۜ وَكَفٰى بِاللّٰهِ وَكِيلًا
﴿٣﴾ مَا جَعَلَ اللّٰهُ لِرَجُلٍ مِنْ قَلْبَيْنِ فِي جَوْفِهِۚ

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (يَآ اَيُّهَا النَّبِيُّ اتَّقِ اللّٰهَ وَلَا تُطِعِ الْكَافِرِينَ وَالْمُنَافِقِينَ) -** (Allah-Təala Qurani-Şərifdə Allah Rəsuluna xitab edərkən onun hörmət və şərəfinə görə adını tərk edib, (ey nəbi və ya ey rəsul) şəklində xitab edibdir, bu ayədə olduğu kimi. Amma digər insanların adları ilə onlara xitab edibdir). **Mübarək ayənin mənası belədir). Ey mənim peyğəmbərim, Allah-Təalaya qarşı təqvalı** (daha dindar) **olmaq üçün çalışıb sabit ol. Kafir və münafiqlərdən uzaq olub, üz döndərib, heç bir işdə onlarla məşvərət edib qəbul etmə. (اِنَّ اللّٰهَ كَانَ عَلِيمًا حَكِيمًاۙ) - Həqiqətən, Allah-Təala haqqı batildən, faydalı olanı fəsad verəndən fərqləndirməyə qadirdir, hər bir feil ondan hikmət üzrə çıxar.** (Ey Məhəmməd), **Allah-Təaladan sənə gəldi, haqq və məsləhət olan odur. Kafir və münafiqlərin rəyi batil və fəsad salandır. Gərək onlardan üz döndərəsən.**

**2) (وَاتَّبِعْ مَا يُوحٰٓى اِلَيْكَ مِنْ رَبِّكَ) -** (Ey Məhəmməd), **hər bir hökm ki, rəbbin Allah-Təaladan sənə vəhy olunur, ona tabe olub kafir və münafiqlərin heç bir sözünə qulaq vermə. (اِنَّ اللّٰهَ كَانَ بِمَا تَعْمَلُونَ خَبِيرًاۙ) - Həqiqətən, o Allah-Təala ki, sənə vəhy göndərir, sizin əməllərinizə agahdır. Hər bir əməllərinizin islahını sizə vəhy edəcəkdir. Kafir və münafiqlərin rəyinə ehtiyacınız olmayacaqdır.**

**3) (وَتَوَكَّلْ عَلَى اللّٰهِ ۜ وَكَفٰى بِاللّٰهِ وَكِيلًا) -** (Ey Məhəmməd), **hər bir işdə Allah-Təalaya təvəkkül edib bütün işlərin tədbirini Allaha həvalə et. Hər bir işin hazır olması üçün Allah-Təala yetər.**

**4-5) (مَا جَعَلَ اللّٰهُ لِرَجُلٍ مِنْ قَلْبَيْنِ فِي جَوْفِهِۚ) - Allah-Təala heç bir nəfərdən ötrü iki qəlb təyin etməyibdir. Qüreyş camaatından*** (Əbu Muammər Həmid ibn Muammər əl-Fəhri) **onların arasında ağıllı və kamal sahibi bir şəxs idi. Hər eşitdiyi sözü tam yadında saxlayardı. Qüreyş deyirdi ki, Əbu Muammərin iki qəlbi olduğu üçün bu qədər sözü yadında saxlaya bilir.**

وَمَا جَعَلَ اَزْوَاجَكُمُ الّٰٓـِٔي تُظَاهِرُونَ مِنْهُنَّ اُمَّهَاتِكُمْۚ وَمَا جَعَلَ اَدْعِيَٓاءَكُمْ اَبْنَٓاءَكُمْۜ ذٰلِكُمْ قَوْلُكُمْ بِاَفْوَاهِكُمْۜ وَاللّٰهُ يَقُولُ الْحَقَّ وَهُوَ يَهْدِي السَّبٖيلَ ﴿٤﴾

---

**Əbu Muammər özü də deyirdi ki, mənim iki qəlbim var. Hər biri ilə Məhəmmədin qəlbindən artıq dərk edib xəbərdar oluram. Allah-Təala bu mübarək ayədə bu şəxsi inkar edir. Allah-Təalanın hikməti bir şəxsdə iki qəlbin olmasını vacib etməz. Çünki əgər Allah-Təala bir şəxsdə iki qəlb yaratsa, o şəxs o iki qəlbin biri ilə həmin isimlər yerinə yetirər ki, o biri qəlbi ilə də eyni o hərəkəti meydana gətirər. O vaxt iki qəlbdən biri artıq olar. Ya da ki qəlbin biri ilə o biri qəlbin əməlinin ziddini əmələ gətirər. O vaxt o şəxsin öz feilindən həm razı, həm narazı, həm ona inamı, həm də şübhəsi olması gərəkdir. Bu ziddiyyətlər bir məqamda cəm ola bilməz. Beləliklə, bir şəxsdən ötrü iki qəlb ola bilməz. Cahiliyyət zamanında bir şəxs öz arvadına deyirdi: "Sən mənə anamın kürəyi kimisən". Bu sözü talaq hesab edib arvadı boşayardı. Buna "zihar" deyirlər. Ziharın hökmü islam dinində nədir? Bundan sonra 28-ci cüzün əvvəlində "Mücadələ" surəsində bəyan ediləcəkdir. Lakin sıradakı ayə zihar olunan arvadın ana kimi haram sayılmasının inkarını bəyan edir.**

**(وَمَا جَعَلَ اَزْوَاجَكُمُ الّٰٓـِٔي تُظَاهِرُونَ مِنْهُنَّ اُمَّهَاتِكُمْ) - O arvadlarınızı ki, onları** (zihar) **edib analarınızın kürəyinə oxşadırsınız, onları Allah-Təala sizdən ötrü ana təyin etməyibdir. Bəlkə, analarınız o arvadlardır ki, onlardan doğulubsunuz.** (Zihar) **etməklə arvadlar sizə əbədi haram olmazlar.** (Ərəblərdə adət idi ki, hər bir şəxs başqa bir şəxsin uşağına oğul deyib onu oğulluğa götürsəydi, onu öz oğlu kimi hesab edib, həqiqətən, oğul deyərdi və həqiqi oğul kimi ona miras verərdilər. Allah-Təala sıradakı ayədə bu mətləbi rədd edir). **(وَمَا جَعَلَ اَدْعِيَٓاءَكُمْ اَبْنَٓاءَكُمْ)* - Özgə şəxslərin övladlarını hansı ki onları öz övladınız təyin edib onlara oğul şəklində xitab edirsiniz, Allah-Təala onları sizə həqiqi oğul təyin etməyib ki, sizə varis olsunlar. (ذٰلِكُمْ قَوْلُكُمْ بِاَفْوَاهِكُمْ) - Sizin bu sözünüz ki, deyirsiniz** (özgə şəxsin oğluna) **- bu mənim oğlumdur, ağzınızda deyilən bir sözdür. Onun əsli və həqiqəti yoxdur. Sizin bu sözünüzlə özgə şəxsin oğlu sizə həqiqi oğul olmaz.**

**(وَاللّٰهُ يَقُولُ الْحَقَّ وَهُوَ يَهْدِي السَّبٖيلَ) - Haqq söz deyib haqq yola hidayət edən Allah-Təaladır.** (Bunun kimi, haqq sözlərdən bundan sonra da bəhs edilir).

*(***Qeyd:** "Allah-Təala bu mübarək ayədə Allah Rəsulunun qulu Zeyd ibn Harisəni misal verir. Cahiliyyə dövründə ərəblərin adəti olan bir-birini qətl, qarət və əsir etmək olduğuna görə Zeyd ibn Harisəni Bəni Kəlb camaatından uşaq ikən əsir etdilər. Hakim ibn Hizam həmin Zeydi xalası Xədicə Xuveylid üçün satın aldı. O zaman ki Allahın Rəsulu (s.a.v.) Xədicə ilə evləndi, Xədicə Zeydi peyğəmbərə bağışladı. Zeydin atası və əmisi gəlib Zeydi istədilər. Allahın Rəsulu Zeydin özünə gedib-qalmaqda sərbəstlik verdi. Zeyd peyğəmbəri*

اُدْعُوهُمْ لِاٰبَآئِهِمْ هُوَ اَقْسَطُ عِنْدَ اللّٰهِ ۚ فَاِنْ لَمْ تَعْلَمُوٓا اٰبَآءَهُمْ فَاِخْوَانُكُمْ فِي الدِّينِ وَمَوَالِيكُمْ ۜ وَلَيْسَ
عَلَيْكُمْ جُنَاحٌ فِيمَآ اَخْطَاْتُمْ بِهٖ ۙ وَلٰكِنْ مَا تَعَمَّدَتْ قُلُوبُكُمْ ۜ وَكَانَ اللّٰهُ غَفُورًا رَحِيمًا ﴿٥﴾ اَلنَّبِيُّ اَوْلٰى
بِالْمُؤْمِنِينَ مِنْ اَنْفُسِهِمْ

---

*seçib onun yanında qaldı. Allahın Rəsulu da onu azad etdi. Qüreyş camaatı Məkkədə ona Zeyd Məhəmməd oğlu deyirdilər. Allah-Təala ayədə onlara bu sözü deməyi qadağan edir. Zeyd uca səhabələrdən biri olub Allah Rəsuluna yaxın idi. Məkkənin fəthindən sonra Suriyada Mütə savaşı oldu. Allahın Rəsulu Zeyd ibn Harisəni o savaşda ordu sərkərdəsi təyin etdi. Buyurdu ki, əgər o savaşda Zeyd şəhid olsa, Abdullah ibn Rəvahə sərkərdə olsun. Əgər o da şəhid olsa, Cəfər ibn Əbu Talib sərkərdə olsun. Əgər o da şəhid olsa, müsəlmanlar özlərindən ötrü sərkərdə təyin etsinlər. O savaşda bu 3 nəfər şəhid oldu. Ondan sonra ordu özünə məşhur fateh Xalid ibn Vəlidi sərkərdə seçdi. Fəth edib Mədinəyə qayıtdılar. Allahın Rəsulu xəstələndiyində bir ordu qurub həmin Zeydin oğlu Üsaməni 21 yaşında sərkərdə təyin edib yenidən Mütə savaşına atasının qanını almaqdan ötrü göndərdi. O savaşda uca səhabənin Üsamənin rəhbərliyi altında olmasını əmr etdi. Allah Rəsulunun xəstəliyi şiddətləndiyindən ordunun tədarükü tamamlanmadı. Ordu Mədinədən ayrılmamış peyğəmbər (s.a.v.) dünyadan köçdü. Mədinə əhli xilafət (hakimiyyət) işi ilə məşğul olub Allah Rəsulunun təyin etdiyi ordunun işi yarımçıq qaldı. O zaman ki, şura və əksəriyyətin vasitəsilə Əbu Bəkir xəlifə olub hakimiyyətə gəldi, birinci işi o oldu ki, peyğəmbərin təyin etdiyi ordunun əskikliklərinin tamamlanmasını əmr edib, Üsamə ibn Zeydin rəhbərliyi altında Mütəyə yola saldı. Üsamə gedib fəth və qələbəyə müvəffəq oldu. Suriyanın fəthinin başlanğıcı belə başladı).*

**5) (اُدْعُوهُمْ لِاٰبَآئِهِمْ هُوَ اَقْسَطُ عِنْدَ اللّٰهِ) - Onlara ki, oğul deyirsiniz, onları atalarının adıyla çağırmaq Allah-Təala yanında daha ədalətlidir.** (Çünki hər bir şəxs atasına aid olub nəsil işi hərc-mərc olmaz)**.**

**(فَاِنْ لَمْ تَعْلَمُوٓا اٰبَآءَهُمْ فَاِخْوَانُكُمْ فِي الدِّينِ وَمَوَالِيكُمْ ۜ) - Əgər onların atalarından xəbərdar olmasanız, islam dinində sizin qardaşlarınız və dostlarınızdırlar. Onlara xitab edəndə qardaş və dost deyin. Amma oğlum demək lazım deyil. (وَلَيْسَ عَلَيْكُمْ جُنَاحٌ فِيمَآ اَخْطَاْتُمْ بِهٖ ۙ) - Əgər xəta edib bir özgə şəxsin oğlunu bu qadağa qoyulmadan əvvəl, həqiqətən, özünüzə oğul təyin etsəniz, heç bir günah yoxdur. (وَلٰكِنْ مَا تَعَمَّدَتْ قُلُوبُكُمْ) - Lakin qadağan olunandan sonra qəsdən və istəyərək bir özgə şəxsin oğlunu özünüzə oğul seçməkdə sizə günah vardır. (وَكَانَ اللّٰهُ غَفُورًا رَحِيمًا) - Tövbəkarlara Allah-Təala rəhm edib onların tövbəsini bağışlayandır.**

**6) (اَلنَّبِيُّ اَوْلٰى بِالْمُؤْمِنِينَ مِنْ اَنْفُسِهِمْ) - Peyğəmbər (s.a.v.) möminlərə* hər bir din və dünya işlərindən üstündür.**

وَاَزْوَاجُهُ اُمَّهَاتُهُمْ ۜ وَاُو۬لُوا الْاَرْحَامِ بَعْضُهُمْ اَوْلٰى بِبَعْضٍ ف۪ي كِتَابِ اللّٰهِ مِنَ الْمُؤْمِن۪ينَ وَالْمُهَاجِر۪ينَ
اِلَّا اَنْ تَفْعَلُوٓا اِلٰٓى اَوْلِيَٓائِكُمْ مَعْرُوفًاۜ كَانَ ذٰلِكَ فِي الْكِتَابِ مَسْطُورًا ﴿٦﴾ وَاِذْ اَخَذْنَا مِنَ النَّبِيّ۪نَ
م۪يثَاقَهُمْ وَمِنْكَ وَمِنْ نُوحٍ وَاِبْرٰه۪يمَ وَمُوسٰى وَع۪يسَى ابْنِ مَرْيَمَ ۖ وَاَخَذْنَا مِنْهُمْ م۪يثَاقًا غَل۪يظًاۙ ﴿٧﴾

---

*(***Qeyd:** *"Əgər islam ümməti Qurani-Şərifin açıq-aydın ayələrinə və uca peyğəmbərin hədisi-şəriflərdə varid olan ali fərmanlarına əməl etsələr, bu zamanda düçar olduqları fəlakətli günlərə düşməzdilər. Amma bizdə uca peyğəmbərin Qurani-Şərifdən başqa möcüzəli dili ilə bəyan etdiyi din və dünya işlərindən heç biri yoxdur. O hədislər necə olub, hara gedibdir, bir qrup o hədisləri zəif, əməl edilməyən güman edib, kənara qoyub, yalan hədisləri özləri üçün dəlil seçiblər. Bir qrupun arasında peyğəmbərin hədisləri qəbul edilsə də, onların əməlləri o hədislərə xilaf olduğuna görə, o hədislər də onların arasında yox hökmündədir. O hədislərdən xəbərdar olanlar Allahın Rəsulunun haqlılığına və elminin genişliyinə agah olarlar).*

**Buna görə də Allah Rəsulunun hər bir hökmünə tabe olmağı gərək vacib bilib, islam ümməti öz istəklərini kənara qoyub, onun tabe olunması vacib olan ehkamına itaət edib, əməl etsinlər. (**وَاَزْوَاجُهُ اُمَّهَاتُهُمْ**) -** (Allah Rəsulunun xanımlarına möminlər ehkamın şərti olaraq təzim və ehtiram edib, onlar üçün ana kimi olub, evlənmələri də haramdır). **Necə ki anaya təzim etmək vacib və nikahlamaq haramdır, habelə Allah Rəsulunun xanımları da etdir.** (İslamın ilk dövrlərində miras hökmü verilmədən əvvəl müsəlmanlar dostluğa görə, ya da hicrət edərkən bir-birilərinə mirasçı olurdular, növbəti ayədə Allah-Təala bu kimi mirası qadağan, qohumluqla mirasçı olmağı isə sabit edir. Ondan sonra Nisa surəsində miras ehkamının açıqlamasını verir). **(**وَاُو۬لُوا الْاَرْحَامِ بَعْضُهُمْ اَوْلٰى بِبَعْضٍ ف۪ي كِتَابِ اللّٰهِ مِنَ الْمُؤْمِن۪ينَ وَالْمُهَاجِر۪ينَ**) - Allah-Təala peyğəmbərinə vəhy edib vacib hökmlərin sırasında dostluq və hicrətlə bir-birinə mirasçı olan mömin və mühacirlərdən əvvəl qohumların mirasçı olmasını üstün saymışdır. Qohumlar olan yerdə dostluq və hicrətlə mirasçı olmaq caiz deyil. (**اِلَّا اَنْ تَفْعَلُوٓا اِلٰٓى اَوْلِيَٓائِكُمْ مَعْرُوفًا**) - Mirasçı olmaq qohumlara məxsusdur. Yad şəxslər miras məsələsində qohumlara şərik ola bilməzlər. Lakin əgər siz möminlər ölmədən əvvəl dostlarınıza bir mənfəət vermək istəyib onlara malınızdan bir şey bağışlasanız, ya da ki vəsiyyət etsəniz ki, malınızdan onlara bir şey versinlər, onun zərəri yoxdur. Bəlkə ,yaxşı bir əməldir, amma miras qohumlara aiddir. (**كَانَ ذٰلِكَ فِي الْكِتَابِ مَسْطُورًا**) - Bu bəhs olunan hökmləri Allah-Təala peyğəmbərinə vəhy edib, vacib etdiyi hökmlərin sırasında sabit və bərqərardır. Gərək, bu cür də olsun.**

**7) (**وَاِذْ اَخَذْنَا مِنَ النَّبِيّ۪نَ م۪يثَاقَهُمْ وَمِنْكَ وَمِنْ نُوحٍ وَاِبْرٰه۪يمَ وَمُوسٰى وَع۪يسَى ابْنِ مَرْيَمَ ۖ وَاَخَذْنَا مِنْهُمْ م۪يثَاقًا غَل۪يظًاۙ**) - Yadına sal** (ey Məhəmməd), **o zaman ki peyğəmbərlərdən, xüsusən, səndən və Nuh, İbrahim, Musa və Məryəm oğlu İsadan möhkəm söz aldıq**

لِيَسْئَلَ الصَّادِقِينَ عَنْ صِدْقِهِمْ ۚ وَاَعَدَّ لِلْكَافِرِينَ عَذَابًا اَلِيمًا ۟ ﴿٨﴾

**ki, peyğəmbərlik edib bizim ehkamı xalqa çatdırsınlar. Peyğəmbərlərdən çox şiddətlə söz almışdıq.**

**8) (لِيَسْئَلَ الصَّادِقِينَ عَنْ صِدْقِهِمْ) - O sözü Allah-Təala peyğəmbərlərdən aldı ki, qiyamət günündə doğru şəxslərdən peyğəmbərlərin peyğəmbərliyini soruşsun. Bəs sizdən peyğəmbərlərin doğruluğunu təsdiq edənlər kimdir? O vaxt peyğəmbərlər onları təsdiq edən möminlərin doğruluğuna şəhadət edərlər. Allah-Təala da o möminlərə savab, mükafat bəxş edəcəyini buyurur. (وَاَعَدَّ لِلْكَافِرِينَ عَذَابًا اَلِيمًا) - Necə ki Allah-Təala peyğəmbəri təsdiq edənlərə savab, mükafat buyurur, habelə peyğəmbərlərə kafir olanlardan ötrü də əziyyət verən əzab hazır edibdir.** (Allah-Təala səradakı ayələrdə Xəndək (Əhzab) savaşının gedişatını xəbər verir. Ayələrin mənasından bəhs etmədən əvvəl, o savaşın gedişatı, gərək, müxtəsər şəkildə bəyan edilsin ki, ayələrin mənasına baxanlar məlumat sahibi olsunlar. İmam Buxari Uqbədən rəvayət edərək deyir: “Xəndək savaşı hicrətin 3-cü ili, şəvval ayında oldu. Tarixçilərdən Məhəmməd ibn İshaq Xəndək savaşının gedişatını bu şəkildə anladır: “Mədinədə olan yəhudilərdən bir neçə nəfər, o cümlədən Səllam b. Əbil-Huqayq ən-Nadari, Huyey ibn Axtab, Kinanə ibn Rəbi və Əbu Əmmar əl-Vaili) **və onlardan başqa Bəni-Nəzir və Bəni-Vail yəhudiləri Mədinədən çıxıb Məkkəyə Qüreyşin yanına gedib onları Allahın Rəsulu ilə savaşa dəvət etdilər. Dedilər: “Biz də sizinləyik ki, Məhəmmədin işini birdəfəlik bitirək”. Qüreyş bu mətləbə sevinib onlarla müqavilə imzaladı. Yəhudilər oradan çıxıb Qətəfan qəbiləsinə gedib onları peyğəmbərlə savaşa dəvət edib dedilər: “Qüreyş camaatı bu məsələdə bizimlə müqavilə imzalayıb həmfikir olublar”. Qətəfan camaatı bunu qəbul edib onlarla müqavilə bağladılar. Qüreyş camaatı Məkkədən və Məkkə ətrafında olan Bəni-Kinanə və Əhabiş camaatından 10 min nəfər qoşun yığıb rəisləri Əbu Süfyan ibn Hərb, Qətəfan camaatı və digər qəbilələr də onlara qoşulub rəisləri Uyeynə ibn Hısn olmaqla hamısı Mədinəyə tərəf yönəldilər. Mədinədə Allahın Rəsulu (s.a.v.) bu məsələdən xəbərdar olub uca səhabədən Səlmanın rəyi ilə Mədinə ətrafında xəndək qazdılar. Bu səbəbdən o savaşa Xəndək savaşı deyilir. Xəndək qazmaq ərəblərdə adət deyildi. Amma İranda adət olduğu üçün Səlman xəndəyi onlardan ötrü hazır etdi. Allahın Rəsulu xəndəyi səhabə arasında bölüb hər 10 nəfərə bir yer verdi. Salman güclü bir şəxs olduğu üçün mühacir və ənsardan hər kəs Salmana görə mübahisə etdi. Mühacirlər dedi: “Bizimlə olsun”, ənsar dedi: “Bizimlə olsun”. Peyğəmbər buyurdu: “Salman bizim əhlibeytdəndir (ev əhlindəndir)”. Allahın Rəsulu özü torpaq qazıb deyirdi: “ey Allahım, həqiqi həyat axirət həyatıdır. Ənsar və mühacirə rəhm et!” Ənsar o cənaba cavab verib dedi:**

**“Biz Məhəmmədə biyət edənlərik. Həyatda olduqca cihaddır qayəmiz”. Elə ki Allahın Rəsulu xəndək işini bitirdi, Qüreyş camaatı gəlib bir tərəfə yerləşdi, Qətəfan digər qəbilələrlə gəlib o biri tərəfə yerləşdilər. Allahın Rəsulu 3 min nəfərlə Mədinədən çıxıb kafirlərlə üzbəüz arada xəndək olmaqla yerləşdilər. O tərəfdən Bəni-Nəzir yəhudilərinin rəisi Huyey ibn Əxtab, Bəni Qüreyzə rəisi Kəb ibn Əsədin yanına getdi. Elə ki Kəb onun gəlməyindən xəbərdar oldu, əmr etdi, qəbilənin qapısını bağladılar. Huyey ibn Axtab icazə istəsə də, Kəb izin vermədi. Qalanın kənarından səsləndi: “Kəb, qapını aç”. Kəb dedi: “Sən uğursuz bir adamsan, mən Məhəmmədlə müqavilə bağlamışam, ondan vəfa və yaxşılıq görmüşəm, əhdimi sındırıb savaşa gedən deyiləm”. Huyey dedi: “Qapını aç ki, səninlə danışım”. Kəb dedi: “Açan deyiləm”. Huyey dedi: “Məlum oldu ki, qapını niyə bağlayıbsan, qorxursan ki, birdən gəlib sənin yeməyini yeyərik”. O vaxt Kəb naçar qalıb qapını açdı. Huyey ibn Axtab içəri daxil olub dedi: “Yazıq olsun sənə, ey Kəb, dünyanın izzət və calalını səndən ötrü gətirmişəm. Qüreyş və Qətəfan qəbiləsinin ağsaqqalları bir yerdə gəlib mənimlə müqavilə bağlayıblar ki, buradan getməsinlər ki, Məhəmməd və onun səhabəsinin işini bitirsinlər”. Kəb dedi: “And olsun Allah-Təalaya, dünyanın zillət və alçaqlığını məndən ötrü gətiribsən. Məni və Məhəmmədi öz halımızda qoyub bizdən uzaq ol. Mən Məhəmməddən doğruluq və vəfadan başqa bir şey görməmişəm”. Huyey ibn Axtab Kəbdən əl çəkməyib şeytan kimi ona vəsvəsə verib axır ki, onu razı saldı. Bir şərtlə ki, Qüreyş Məhəmmədə bir zərər verməyib qayıdıb getsə, Huyey ibn Axtab onun qalasına daxil olsun, nə zərər gəlsə, ona da gəlsin. Bu mətləblə müqavilə bağlayıb and içdilər. Kəb müqaviləni pozub peyğəmbərlə savaşmaq üçün qalasından çıxdı. Allahın Rəsulu bu mətləbdən xəbərdar olub 4 nəfərə - Evs camaatının ağası Səd ibn Muaz, Xəzrəc camaatının ağası Səd ibn Übadə,Abdulla ibn Rəvahə və Xəvvat ibn Cübeyrə buyurdu ki, Bəni Qüreyzədən bizə gələn xəbər doğrudur, ya yox, doğrudursa gəlib mənə işarə ilə xəbər verin. O 4 nəfər Bəni-Qüreyzə qalasına gedib baxıb gördülər ki, camaat və rəisləri Kəb ibn Əsəd müqaviləni pozublar. Səd ibn Übadə bir qəzəbli şəxs idi, onları söyüb, onlar da onu söyüb peyğəmbər haqqında nalayiq sözlər dedilər. Səd ibn Muaz onu sakit edib peyğəmbərin yanına qayıdıb məsələni işarə ilə Allahın Rəsuluna bildirdilər. Peyğəmbər: “Allahu əkbər”, dedi. O vaxt müsəlmanların işi dara düşüb qorxu da onları bürüyüb, hər bir tərəfdən düşmən onları əhatə etdi. Münafiqlər ikiüzlülüklərini göstərdilər. Münafiq olan Muattib ibn Quşeyir dedi: “Məhəmməd bizə İran və Rum sultanlarının xəzinələrini vəd edirdi, indi ehtiyaclarımızı həll etməyə qüdrətimiz yoxdur, onun vədlərinin hamısı yalandır”. Münafiqlərin hər biri bir söz dedi. Bu şəkildə müşriklər xəndəyin ətrafında, Allahın Rəsulu da bu biri tərəfdə 20 gündən çox qal-**

**dılar. Ancaq ox ataraq savaşırdılar. Allahın Rəsulu baxıb gördü ki, işləri çətindir. Qətəfan qəbiləsinin rəisi Uyeynə ibn Hısnın yanına qasid göndərib onu sülhə dəvət etdi. O, Mədinə xurmalıqlarının üçdə birinin ona verilməsi şərti ilə ordusunu götürüb getməyə razı idi. O da bu şərtlə razı olub müqavilə mətni yazıldı. Şahidlər ona imza atmamış mətni Allahın Rəsulunun yanına gətirdilər. Peyğəmbər bu məsələni Səd ibn Muaz və Səd ibn Übeydəyə bəyan edib onlarla məşvərət etdi. Dedilər: "Ey peyğəmbər, bu, Allah-Təala tərəfindəndir, yoxsa bizim xeyrimizi düşünüb öz yanından bu tədbiri görübsən?" Buyurdu: "Sizin xeyrinizi düşünüb, öz yanımdan bu tədbiri görmüşəm". Dedilər: "Ey peyğəmbər, biz hələ müşrik olanda heç bir nəfər bizim malımıza tamah sala bilməzdi, indi ki Allah-Təala bizə hidayət edib islam dini ilə şərəflənmişik, malımızı götürüb onlara verək, bu, mümkün olan iş deyil. Bizimlə onların arasında qılıncdan başqa bir şey yoxdur". Allahın Rəsulu buyurdu: "Siz razı deyilsinizsə, mən də razı deyiləm". Səd ibn Muaz müqavilə mətnini cırıb atdı. Hamısı ölməyə hazır oldu. Qüreyş tayfasından bir neçə nəfər şücaətli şəxs - 1) Əmr ibn Abdud 2) İkrimə ibn Əbu Cəhl 3) Hübeyrə ibn Əbu Vəhb, Novfəl ibn Abdulla ibn Darar ibnül-Xəttab 5) Mirdas (Bəni-Müharib camaatından) 6) Münəbbih ibn Osman ibn Abduddar atlarına minib xəndək tərəfinə yönəldilər. Gəlib xəndəyə yetişib dayandılar. Dedilər: "And olsun Allah-Təalaya, bu bir məkr, hiylədir ki, ərəblər buna agah deyil". Ondan sonra xəndəyin ətrafını dolanıb bir dar yer tapıb atlarına səsləndilər. Atlar sıçrayaraq xəndəyin o biri tərəfinə keçdilər. Müsəlmanlar onlarda bu şücaəti görəndə hamısı qorxuya düşüb, pərişan olub qəlbləri yerindən oynadı. Müşriklər o halda durub rəqib istədilər. Əli ibn Əbu Talib (ə.s) bir neçə nəfərlə onların qarşısına çıxıb xəndəyin dar yerinin qabağında durdular ki, yenidən keçməyə qadir olmasınlar. Əmr ibn Abdud Bədir savaşında ağır yaralanıb Uhud savaşına qatıla bilməmişdi. Uhud savaşının əvəzinə Xəndək savaşına gələndə başına quş lələyindən bir işarət taxmışdı. Bu mənada ki, savaşdan qaçan deyiləm. Şücaətli ərəblər savaşa gedərkən başlarına bir işarət qoyardılar. Əli (ə.s) savaşlarda həmişə belə işarət taxardı. Elə ki üzbəüz oldular, Əli (ə.s) dedi: "Ey Əmr, sən həmişə Allah-Təalaya söz veribsən ki, əgər bir Qüreyşli şəxs səndən iki şey xahiş etsə, sən onlardan birini qəbul edəcəksən". Əmr dedi: "Etdir". Əli dedi: "Əvvəlcə mən səni Allah-Təala və onun peyğəmbəri Məhəmməd (s.a.v.) və islam dininə tərəf dəvət edirəm, gəl müsəlman ol". Əmr dedi: "Mənim islam dininə ehtiyacım yoxdur". Əli dedi: "İndi səni savaşa dəvət edirəm, gəl savaşaq". Əmr dedi: "Qardaş oğlu, niyə məni savaşa çağırırsan, and olsun Allah-Təalaya, mən səni öldürmək istəmirəm". Əli dedi: "Lakin mən səni öldürmək istəyirəm". O vaxt Əmr hirslənib atından düşüb atının ayağından qılıncla vurdu. At yıxılıb, o da Əliyə yaxınlaşdı. Əli (ə.s)**

ona fürsət verməyib onu öldürdü. Əmr öldürülən kimi dostları qaçıb xəndəkdən keçdilər. Onlardan ikisi öldürüldü, biri Münəbbih ibn Osman ibn Abduddar ki, ona bir ox dəyib Məkkədə öldü, o birisi - Novfəl ibn Abdullah ibn Darar ibnül-Xəttab qaçan vaxt atı xəndəkdən keçə bilməyib xəndəyə düşdü. Müsəlmanlar onu daşa basdılar. Dedi: "Ey ərəb camaatı, bir dəfə öldürmək bundan yaxşıdır". Əli (ə.s) xəndəyə düşüb onu öldürdü. Neçə gün o halda savaşsız qaldılar. Qətəfan camaatından Nüeym ibn Məsud gizlincə Allahın Rəsulunun hüzuruna gedib dedi: "Ey peyğəmbər, mən islama daxil olmuşam, lakin mənim camaatım mənim islama daxil olmağımdan xəbərdar deyildir. Nə istəyirsən, əmr et, xidmət edim". Allahın Rəsulu buyurdu: "Sən bir nəfərsən, nə qədər gücün var, müşrikləri dağıt, savaş hiylədir, gərək, savaşda hiylə edəsən. Nüeym ibn Məsud oradan çıxıb Bəni-Qüreyzə yəhudilərinin yanına getdi, onlarla cahiliyyət zamanında dost və yoldaş idi. Dedi: "Ey Bəni-Qüreyzə, bilirsiniz ki, mən sizinlə dostam və sizə məhəbbətim var". Dedilər: "Doğru dedin". Dedi: "Bu Qüreyş və Qətəfan camaatı Məhəmmədlə savaşa gəliblər, siz də onlara kömək edirsiniz. Amma Qüreyş və Qətəfan sizin kimi deyil. Bura sizin məkanınızdır, mal da özünüzündür, arvad-uşağınız var, bu yerdən başqa bir yerə getmək sizdən ötrü mümkün deyil. Amma onların mal və övladları özgə yerdədir. Əgər qalib gəlsələr, qənimət alıb aparacaqlar. Amma əgər məğlub olsalar, qaçıb öz bölgələrinə gedəcəklər, siz də burada qalacaqsınız. Allahın Rəsulu da sizinlə qalacaq. O vaxt sizin ona qarşı durmağa gücünüz çatmayacaq. Siz Qüreyş camaatına köməyin qarşılığında onların böyüklərindən bir neçə nəfər girov götürün, o girovların sizin əlinizdə olması səbəbindən Qüreyş sizə kömək edib Məhəmmədlə savaşdan sonra sizi qoyub getməsinlər. Bəni-Qüreyzə dedi: "Yaxşı rəy verib, gözəl nəsihət etdin". O, oradan çıxıb Qüreyş camaatının yanına gedib Əbu Süfyan və Qüreyşin böyüklərinə xitab edib belə dedi: "Bilirsiniz ki, mən Məhəmməddən uzaq olub sizi özümə dost sayıram. Bir xəbər mənə çatıbdır, mən o xəbəri sizə verib nəsihət etməkdə özümü haqlı sayıram. Amma o məsələni gərək gizlədib aşkar etməyək. Dedilər: "Gizlədərik. Dedi: "Bəni Qüreyzənin yəhudi camaatı Məhəmmədlə aralarında olan müqaviləni pozmağa peşman olublar, Məhəmmədin yanına qasid göndəriblər ki, peşman olmuşuq, bəs bizdən razı olarsan ki, Qüreyş və Qətəfan qəbiləsinin böyüklərindən bir neçə nəfər alıb sənə verək, sən də onları öldür. Ondan sonra səninlə bir olub onlarla savaşaq. Məhəmməd də onlara cavab verib ki, razıyam. İndi əgər yəhudilər səndən girov istəsə, bir nəfər də onlara verməyin. Oradan çıxıb Qətəfan qəbiləsinə getdi. Dedi: "Ey Qətəfan camaatı, siz mənim qohumlarımsınız. Sizi hamıdan artıq istəyirəm. Gümanım budur ki, məndən bədgüman olmayasınız. Dedilər: "Doğru dedin". Dedi: "Amma sözlərimi gizlədin, Qüreyşə dediyi

**sözləri onlara da deyib onları qorxutdu”. Şəvval ayının şənbə günü Əbu Süfyan və Qətəfanın böyükləri Bəni-Qüreyzənin yanına İkrimə ibn Əbu Cəhli bir neçə nəfərlə göndərib dedilər: “Bizim burada çox qalmağa taqətimiz yoxdur, heyvanlarımız məhv oldu, savaşa hazır olun ki, Məhəmmədin işini bitirək”. Dedilər: “Biz şənbə günü heç bir işə başlamarıq, həm də savaşmarıq, ta ki, siz bizə gərək bir neçə nəfər girov verəsiniz. Ondan sonra sizə kömək edib savaşa gələrik”. Qayıdıb bu xəbəri Qüreyşə və Qətəfana verdilər. Bu xəbəri eşidəndən sonra Nüeym ibn Məsudun sözünün doğru olmasına inandılar.**

**Bəni-Qüreyzəyə cavab verib dedilər ki, sizə bir nəfər də girov verən deyilik. Bəni-Qüreyzə də bu sözü eşidib Nüeym ibn Məsudun sözünün haqq olduğuna inandılar. Nüeym ibn Məsud onların arasına nifaq salıb onlar da ixtilafa düşdülər. Allah-Təala o gecə şiddətli bir külək göndərdi. Onların canını yaxıb, odlarını keçirib, küləyin şiddətindən göz açmaq onlara mümkün olmadı. Onların arasına düşən ixtilaf xəbəri Allahın Rəsuluna yetişdi. Huzeyfə ibnül-Yəmani deyir: “Həmin gecə Allahın Rəsulu buyurdu: “Kim bu gecə gedib bu camaatdan mənə xəbər gətirəcək? Bir nəfər cavab verən olmadı. Durub namazla məşğul oldu. Gecədən bir müddət keçdi. Yenidən soruşdu: “Görəsən, bir adam var ki, gedib baxıb görsün, bu camaatın işi necə oldu?” Şiddətli qorxu səbəbi ilə heç kim ayağa durmadı. Yenə Allahın Rəsulu namazla məşğul oldu. Bir qədər sonra buyurdu: “Bəs bir adam yox ki, gedib bir xəbər gətirsin?” Cavab verən olmadı. Elə ki, Allahın Rəsulu gördü ki, cavab verən yoxdur, məni adımla çağırıb buyurdu: “Ey Huzeyfə”, məni adımla çağıranda çarəsiz qalıb dedim: “Buyurun, ey peyğəmbər”, gedib hüzurunda durdum. Əlimdən tutub möcüzə bəxş edən əlini mənim başıma, üzümə sürtüb buyurdu: “Get, bu camaatdan bir xəbər gətir”. Ondan sonra mənə dua etdi, mən də yola düşüb getdim. Amma, sanki, ölməyə gedirdim. Gedib camaatın arasına daxil oldum. Gördüm küləyin şiddətindən çadırları yıxılıb, odları dağılıb bir-birilərinə qarışıblar. Əbu Süfyan deyirdi: “Ey Qüreyş camaatı, hər şəxs öz yanındakı şəxsin əlindən tutub görsün kimdir?” Huzeyfə deyir: “Bu sözü eşidən kimi yanımda olanın əlindən yapışıb dedim kimsən?” Dedi: “Allah böyükdür, mən filan ibn filanam”. Əbu Süfyan deyirdi: “Ey Qüreyş camaatı, heyvanlarımız həlak oldu. Bəni-Qüreyzə bizə müxalif oldu. Daha bizim burada qalmağımız mümkün deyil. Qalxıb köç edək, budur mən yola düşürəm”. Bu sözü deyib dəvəsinin bir ayağı bağlı olan halda ona minib dəvə 3 ayağının üstünə qalxdı. Dəvəni o halda görəndə, əyilib dəvənin ayağını açıb yola düşdü. Habelə Qətəfan camaatı da onlar kimi yola düşdülər. Qayıdıb gedib Allahın Rəsuluna olanları xəbər verdim. Peyğəmbər fərəh və sevincindən güldü, ondan sonra istirahət edib yatdı. Mən də onun ayağının altında yatdım. Üstündə olan paltarı mənim**

**də üstümə çəkdi. Allahın Rəsulunun ayaqlarını sinəmə yapışdırıb səhərə kimi yatdım. Sübh vaxtı məni səsləyib buyurdu: "Ey yatan, dur". Ayağa durdum. Mühacir və ənsar Qüreyşin getməyinə şad olmuşdular. Hz. Aişə rəvayət edir ki, "biz Xəndək savaşında Mədinənin möhkəm qalalarından Bəni Harisə qalasına sığınmışdıq. Səd ibn Muazın anası da orda bizimlə birlikdə idi. Gördüm Səd ibn Muaz oradan keçir. Əynində bir qısa dəri (paltar) var idi. Qolları o paltardan çıxmışdı, əlində mizraq belə deyirdi: "Əcəl gələndə, artıq ölümdə o qədər də əhəmiyyət veriləcək bir şey olmaz. Anası dedi: "Oğul, get, and olsun Allah-Təalaya, ölməyi seçmisən". Mən dedim: "Ey Sədin anası, Sədin paltarı, gərək, bu qədər qısa olmayaydı. Ona ox dəyməsindən qorxuram". Həmin gün Sədin əlinə bir ox dəyib əlindəki qalın damarı kəsdi, qanı dayanmadı. Səd dedi: "İlahi, əgər Qüreyşin yenə bizimlə savaşı olacaqsa, məni öldürmə, bir camaat ki, sənin peyğəmbərini təkzib edib onu öz yerindən qovub, onlarla cihad etməyi çox istəyirəm. Əgər bizimlə onların arasındakı savaşı bitiribsənsə, mənə şəhidlik qismət et. Amma məni sənin peyğəmbərinlə müqaviləsini pozan Bəni-Qüreyzə tərəfindən öldürtmə ki, gözüm işıqlansın". Sədin əlinin qanı dayandı. Elə ki o gecə Qüreyş camaatı dağılıb getdi, Allahın Rəsulu zöhr vaxtı əmr verdi, carçılar da elan etdilər ki, peyğəmbərin hökmü budur ki, gərək, müqaviləni pozan Bəni-Qüreyzəyə hücum edəsiniz. Əsr namazı, gərək, orada qılınsın. Əli ibn Əbu Talibi orduya bayraqdar təyin edib yola saldı. Ondan sonra özü də çıxıb əsr namazı vaxtı Bəni-Qüreyzə qalasına yetişdilər. 25 gün onları mühasirədə saxladılar. Bəni-Nəzir yəhudilərinin rəisi Huyey ibn Axtab Bəni-Qüreyzə yəhudilərinin rəisi Kəb ibn Əsədlə bağladığı müqaviləyə əsasən o da onlarla birlikdə qala idi. Axırda Bəni-Qüreyzə Səd ibn Muazın verdiyi hökmə razı oldu. Səd ibn Muaz Mədinədə qalmışdı, yaralı olanlara Allah üçün xidmət edən Rüfeydə adlı qadın (necə ki, indi də hər bir orduda beləlləri olur) Səd ibn Muaza xidmət edirdi. Gedib Səd ibn Muazı Mədinədən Bəni-Qüreyzə savaşına apardılar. Bəni-Qüreyzə camaatı qalanın qapısını açıb çıxdılar. Bəni-Qüreyzə və Allahın Rəsulu Səd ibn Muazı hakim seçib onun hökmünə razı oldular. Səd hər iki tərəfdən razılıq alıb dedi: "Bəni-Qüreyzə barəsində mənim hökmüm budur ki, gərək, onların içindəki fəsadçılar öldürülüb, qalanları əsir edilib, malları da qarət edilsin. Müqaviləni pozan zalımların cəzası budur. Ondan sonra Sədin əlindən qan yenidən açılıb şəhidliyə qovuşdu. Bəni-Qüreyzənin əhvalatı uzundur, bu qədər yetər. Bəhs olunan qissələr növbəti ayələrdə bəyan olunur.**

**9) (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا اذْكُرُوا نِعْمَةَ اللّٰهِ عَلَيْكُمْ اِذْ جَآءَتْكُمْ جُنُودٌ) - Ey möminlər, yadınıza gətirin Allah-Təalanın nemətlərini o zaman ki sizə ordu** (Qüreyş və Qətəfan) **hücum edib istədilər sizin işinizi bitirsinlər, o vaxt Allah-Təala**

فَاَرْسَلْنَا عَلَيْهِمْ رِيحًا وَجُنُودًا لَمْ تَرَوْهَاۜ وَكَانَ اللّٰهُ بِمَا تَعْمَلُونَ بَصِيرًاۚ ﴿٩﴾ اِذْ جَٓاؤُ۫كُمْ مِنْ فَوْقِكُمْ
وَمِنْ اَسْفَلَ مِنْكُمْ وَاِذْ زَاغَتِ الْاَبْصَارُ وَبَلَغَتِ الْقُلُوبُ الْحَنَاجِرَ وَتَظُنُّونَ بِاللّٰهِ الظُّنُونَا ﴿١٠﴾ هُنَالِكَ
ابْتُلِيَ الْمُؤْمِنُونَ وَزُلْزِلُوا زِلْزَالًا شَدِيدًا ﴿١١﴾ وَاِذْ يَقُولُ الْمُنَافِقُونَ وَالَّذِينَ فِي قُلُوبِهِمْ مَرَضٌ مَا
وَعَدَنَا اللّٰهُ وَرَسُولُهُ اِلَّا غُرُورًا ﴿١٢﴾ وَاِذْ قَالَتْ طَٓائِفَةٌ مِنْهُمْ يَٓا اَهْلَ يَثْرِبَ لَا مُقَامَ لَكُمْ فَارْجِعُواۚ

---

**sizi onlardan xilas etdi. (فَاَرْسَلْنَا عَلَيْهِمْ رِيحًا وَجُنُودًا لَمْ تَرَوْهَاۜ) -** (Qüreyş və Qətəfan) **camaatına külək göndərdik ki, onlar o küləyin qarşısında dura bilmədilər. Küləkdən başqa ordular da göndərdik, amma siz möminlər o orduları görməyibsiniz.** (Təfsirçilər deyiblər ki, o ordudan məqsəd mələklərdir, Allah-Təalanın gizli orduları çoxdur, o cümlədən onların qəlbinə saldığı qorxu kimi. Allah-Təala qorxu qüvvəsini onların qəlbinə daxil edib, daha dayana bilməyib, gecə vaxtı Məkkəyə tərəf qaçdılar. (وَكَانَ اللّٰهُ بِمَا تَعْمَلُونَ بَصِيرًاۚ) - **Allah-Təala siz möminlərin əməllərinə, o cümlədən peyğəmbərin qələbəsi üçün möhkəm çalışmanızdan agahdır.**

**10) (اِذْ جَٓاؤُ۫كُمْ مِنْ فَوْقِكُمْ وَمِنْ اَسْفَلَ مِنْكُمْ) - Allah-Təala siz möminlərə kömək oldu. O zaman ki sizin yuxarı tərəfinizdən** (Qətəfan camaatı cənub-şərqdən) **və aşağı tərəfinizdən** (Qüreyş camaatı cənub-qərbdən) **düşmənlər sizə hücum etdilər. (وَاِذْ زَاغَتِ الْاَبْصَارُ وَبَلَغَتِ الْقُلُوبُ الْحَنَاجِرَ) - Yenə o vaxt Allah-Təala sizə kömək etdiyinə görə gözlər** (sizin gözləriniz) **qorxudan dönüb, ürəyiniz ağzınıza gəlib, nəfəsiniz kəsilsə də, zəiflərə qalib gəlməyə onlarda qüdrət olmadı.** (Müsəlmanların halı Xəndək savaşında belə idi ki, Allah-Təala bildirir). **(وَتَظُنُّونَ بِاللّٰهِ الظُّنُونَا) - Allah-Təalaya müxtəlif zənn və gümanlar bəsləyirdiniz.** (Möminlər qələbəyə, münafiqlər məğlubiyyətə ümid edirdilər).

**11) (هُنَالِكَ ابْتُلِيَ الْمُؤْمِنُونَ) - O vaxt möminlər böyük bəlaya mübtəla olub imtahan olundular ki, ixlaslılar münafiqlərdən seçilsinlər. (وَزُلْزِلُوا زِلْزَالًا شَدِيدًا) - Qorxu onları şiddətli zəlzələ kimi titrədirdi.**

**12) (وَاِذْ يَقُولُ الْمُنَافِقُونَ وَالَّذِينَ فِي قُلُوبِهِمْ مَرَضٌ مَا وَعَدَنَا اللّٰهُ وَرَسُولُهُ اِلَّا غُرُورًا) - O zaman ki, münafiqlər və qəlblərində xəstəlik olan zəif imanlı şəxslər** (Muattib ibn Quşeyir və digər münafiqlər) **dedilər: "Allah-Təala və onun peyğəmbəri olan Məhəmmədin bizə verdiyi vədlər hamısı yalan və iftiradır. İran və Rum sultanlarının xəzinələrini bizə vəd edirdi, halbuki qorxudan kənara çıxa bilmirik. "**

**13) (وَاِذْ قَالَتْ طَٓائِفَةٌ مِنْهُمْ) - O zaman ki münafiqlərdən bir tayfa** (Evs ibn Qeyzi və onunla birlikdə olanlar) **Mədinə əhlinə xitab edib dedilər: (يَٓا اَهْلَ يَثْرِبَ لَا مُقَامَ لَكُمْ فَارْجِعُواۚ) - "Ey Yəsrib* əhli, sizdən ötrü burada durmaq doğru deyil, bu qorxu içində niyə burada durubsunuz? Qayıdıb Mədinəyə gedib evlərinizə yerləşin. Məhəmmədi Qüreyşə həvalə edin".**

وَيَسْتَأْذِنُ فَرِيقٌ مِنْهُمُ النَّبِيَّ يَقُولُونَ اِنَّ بُيُوتَنَا عَوْرَةٌ وَمَا هِيَ بِعَوْرَةٍ اِنْ يُرِيدُونَ اِلَّا فِرَارًا ﴿١٣﴾
وَلَوْ دُخِلَتْ عَلَيْهِمْ مِنْ اَقْطَارِهَا ثُمَّ سُئِلُوا الْفِتْنَةَ لَاٰتَوْهَا وَمَا تَلَبَّثُوا بِهَآ اِلَّا يَسِيرًا ﴿١٤﴾ وَلَقَدْ كَانُوا
عَاهَدُوا اللّٰهَ مِنْ قَبْلُ لَا يُوَلُّونَ الْاَدْبَارَ وَكَانَ عَهْدُ اللّٰهِ مَسْؤُلًا ﴿١٥﴾ قُلْ لَنْ يَنْفَعَكُمُ الْفِرَارُ اِنْ فَرَرْتُمْ
مِنَ الْمَوْتِ اَوِ الْقَتْلِ وَاِذًا لَا تُمَتَّعُونَ اِلَّا قَلِيلًا ﴿١٦﴾

---

*(*Qeyd: "Mədinənin əvvəlki adı Yəsribdir. Qədim zamanlardan orada yaşayan Əmalikə tayfasından bir nəfər olan Yəsrib adlı adamın adı ilə adlandı. Allahın Rəsulu Mədinəyə hicrət edəndən sonra şəhərə "Mədinətür-Rəsul" dedilər, yəni peyğəmbərin şəhəri. Ərəblər hər bir şəhərə "mədinə" deyir. Daha sonra çox istifadə edildiyi üçün Rəsul sözü tərk edilib, Mədinə adı ilə məşhur oldu).*

(وَيَسْتَأْذِنُ فَرِيقٌ مِنْهُمُ النَّبِيَّ يَقُولُونَ اِنَّ بُيُوتَنَا عَوْرَةٌ) - **O münafiqlərdən bir qrup peyğəmbərdən izin almaq üçün dedilər: "Bizə icazə ver, Mədinəyə gedək, evlərimiz üçün qorxuruq, evlərimizi qoruyan yoxdur. Qorxuruq ki, birdən gəlib evlərimizi qarət edərlər, gedib evlərimizi möhkəmlədib sonra qayıdıb davaya hazırlaşaq".** (Allah-Təala onları təkzib edib buyurur:) (وَمَا هِيَ بِعَوْرَةٍ) - **Onlar yalan deyirlər, evləri üçün qorxmurlar,** (اِنْ يُرِيدُونَ اِلَّا فِرَارًا) - (Ey Məhəmməd), **səndən izin alanların istəyi qaçmaqdan başqa bir şey deyildir. Evlərini bəhanə edib qaçmaqdan ötrü səndən izin istəyirlər.**

**14)** (وَلَوْ دُخِلَتْ عَلَيْهِمْ مِنْ اَقْطَارِهَا) - **Əgər münafiqlər Mədinəyə gedib evlərində otursalar, o vaxt sizinlə savaşmağa gələn müşriklər şəhərin kənarından gedib Mədinəyə, onların evlərinə daxil olarlar.** (ثُمَّ سُئِلُوا الْفِتْنَةَ) - **Daxil olandan sonra onlara deyərlər: "İslam dinindən dönüb şirki qəbul edin".** (لَاٰتَوْهَا وَمَا تَلَبَّثُوا بِهَآ اِلَّا يَسِيرًا) - **Şirkə daxil olmaqdan geri qalmazlar, dəvət olunan kimi tez şirkə daxil olarlar. Çünki münafiqdirlər. Münafiqin sifəti budur.**

**15)** (وَلَقَدْ كَانُوا عَاهَدُوا اللّٰهَ مِنْ قَبْلُ لَا يُوَلُّونَ الْاَدْبَارَ) - (Ey Məhəmməd), **halbuki həqiqətən səndən izin istəyib qaçmaq istəyənlər bundan əvvəl həmişə Allah-Təalaya söz verirdilər ki, savaşdan qaçmasınlar, indi bunlara nə olub ki, savaşdan qaçırlar.** (وَكَانَ عَهْدُ اللّٰهِ مَسْؤُلًا) **kim Allah-Təalaya söz verib, vəfalı olsa, Allah-Təalaya verdiyi sözə görə qiyamət günündə cavab verəcəkdir.**

**16)** (قُلْ لَنْ يَنْفَعَكُمُ الْفِرَارُ اِنْ فَرَرْتُمْ مِنَ الْمَوْتِ اَوِ الْقَتْلِ) - (Ey Məhəmməd), **izin istəyib qaçmaq istəyən münafiqlərə de ki, əgər ölməkdən və ya öldürülməkdən qaçırsınızsa, o qaçmaq sizə mənfəət verib ölümdən saxlamaz, o vaxta ki, sizdən ötrü ölüm təyin olunubdur, sizə gələcəkdir.** (وَاِذًا لَا تُمَتَّعُونَ اِلَّا قَلِيلًا) -

قُلْ مَنْ ذَا الَّذِي يَعْصِمُكُمْ مِنَ اللّٰهِ اِنْ اَرَادَ بِكُمْ سُوٓءًا اَوْ اَرَادَ بِكُمْ رَحْمَةً ۚ وَلَا يَجِدُونَ لَهُمْ مِنْ دُونِ اللّٰهِ وَلِيًّا وَلَا نَصِيرًا ﴿١٧﴾ قَدْ يَعْلَمُ اللّٰهُ الْمُعَوِّقِينَ مِنْكُمْ وَالْقَٓائِلِينَ لِاِخْوَانِهِمْ هَلُمَّ اِلَيْنَا ۚ وَلَا يَأْتُونَ الْبَأْسَ اِلَّا قَلِيلًا ۙ ﴿١٨﴾ اَشِحَّةً عَلَيْكُمْ ۚ فَاِذَا جَٓاءَ الْخَوْفُ رَاَيْتَهُمْ يَنْظُرُونَ اِلَيْكَ تَدُورُ اَعْيُنُهُمْ كَالَّذِي يُغْشٰى عَلَيْهِ مِنَ الْمَوْتِ ۚ فَاِذَا ذَهَبَ الْخَوْفُ سَلَقُوكُمْ بِاَلْسِنَةٍ حِدَادٍ اَشِحَّةً عَلَى الْخَيْرِ ۜ اُو۬لٰٓئِكَ لَمْ يُؤْمِنُوا فَاَحْبَطَ اللّٰهُ اَعْمَالَهُمْ ۜ وَكَانَ ذٰلِكَ عَلَى اللّٰهِ يَسِيرًا ﴿١٩﴾ يَحْسَبُونَ الْاَحْزَابَ لَمْ يَذْهَبُوا ۚ وَاِنْ يَأْتِ الْاَحْزَابُ

---

**Qaçandan sonra dünyada qalsanız da, az bir müddət qalıb dünyadan az ləzzət alacaqsınız, ondan sonra ölüm yenə sizə gələcəkdir.**

**17) (قُلْ مَنْ ذَا الَّذِي يَعْصِمُكُمْ مِنَ اللّٰهِ اِنْ اَرَادَ بِكُمْ سُوٓءًا اَوْ اَرَادَ بِكُمْ رَحْمَةً) -** (Ey Məhəmməd), **münafiqlərə de ki, əgər Allah-Təala sizdən ötrü məğlubiyyət və ya qələbə istəsə, Allah-Təalaya kim mane ola bilər? Heç kim mane ola bilməz. (وَلَا يَجِدُونَ لَهُمْ مِنْ دُونِ اللّٰهِ وَلِيًّا وَلَا نَصِيرًا) Onlar özlərindən ötrü Allah-Təaladan başqa nə işlərini idarə edən, nə də bir köməkçi tapa bilməzlər.**

**18) (قَدْ يَعْلَمُ اللّٰهُ الْمُعَوِّقِينَ مِنْكُمْ وَالْقَٓائِلِينَ لِاِخْوَانِهِمْ هَلُمَّ اِلَيْنَا) - Həqiqətən, Allah-Təala agahdır sizdən o şəxslərə ki, xalqa Allahın Rəsuluna kömək edib cihad etməyə mane olub, öz qardaşlarına deyirdilər ki, bizim tərəfimizə gəlib peyğəmbərlə cihada getməyin. (وَلَا يَأْتُونَ الْبَأْسَ اِلَّا قَلِيلًا) - Cihada çox az vaxtlarda gedərlər** (ancaq düşmənin hücumu və çarəsizlik məqamında).

**19) (اَشِحَّةً عَلَيْكُمْ) -** (Ey Məhəmməd), **əgər siz davada düşmənə qalib olsanız münafiqlər paxıllıq edərlər.**

**(فَاِذَا جَٓاءَ الْخَوْفُ رَاَيْتَهُمْ يَنْظُرُونَ اِلَيْكَ تَدُورُ اَعْيُنُهُمْ كَالَّذِي يُغْشٰى عَلَيْهِ مِنَ الْمَوْتِ) -** (Ey Məhəmməd) **o zaman ki savaş olub qorxu yarandı, münafiqləri görərsən ki, sənə sığınıb pənah aparmaqdan ötrü can çəkişməsindən qəşş edib gözləri hədəqəsindən çıxan şəxs kimi sənə baxarlar.**

**(فَاِذَا ذَهَبَ الْخَوْفُ سَلَقُوكُمْ بِاَلْسِنَةٍ حِدَادٍ اَشِحَّةً عَلَى الْخَيْرِ) - O zaman ki qorxu gedib, düşmənə qalib olub, qənimət əldə etdiniz, o vaxt münafiqlər cəsarət edib qənimət olunan maldan ötrü tünd kəskin kimi dilləri ilə sizə əziyyət edib sizin apardığınız mallara paxıllıqlarından deyərlər ki, biz də sizinlə birlikdə cihad etmişik, gərək bizə də qənimətdən verəsiniz. (اُو۬لٰٓئِكَ لَمْ يُؤْمِنُوا) -** (Ey Məhəmməd), **o münafiqlər heç vaxt iman etməyiblər, (فَاَحْبَطَ اللّٰهُ اَعْمَالَهُمْ) - O münafiqlərin dil ilə olan imanlarını və hər bir əməllərini Allah-Təala batil edir, (وَكَانَ ذٰلِكَ عَلَى اللّٰهِ يَسِيرًا) - və onların əməllərini batil etmək Allah-Təalaya çox asandır.**

**20) (يَحْسَبُونَ الْاَحْزَابَ لَمْ يَذْهَبُوا) -** (Ey Məhəmməd), **münafiqlər güman edirlər ki,** (Qüreyş və Qətəfan) **dağılıb getməyiblər, şiddətli qorxudan belə güman edirlər, halbuki dağılıb gediblər, (وَاِنْ يَأْتِ الْاَحْزَابُ) - əgər yenidən** (Qüreyş və Qətəfan) **qayıdıb sizlə savaşa gəlsələr,**

يَوَدُّوا لَوْ اَنَّهُمْ بَادُونَ فِي الْاَعْرَابِ يَسْئَلُونَ عَنْ اَنْبَٓائِكُمْ ۜ وَلَوْ كَانُوا فٖيكُمْ مَا قَاتَلُوٓا اِلَّا قَلٖيلًا۟ ﴿٢٠﴾
لَقَدْ كَانَ لَكُمْ فٖي رَسُولِ اللّٰهِ اُسْوَةٌ حَسَنَةٌ لِمَنْ كَانَ يَرْجُوا اللّٰهَ وَالْيَوْمَ الْاٰخِرَ وَذَكَرَ اللّٰهَ كَثٖيرًاۜ
﴿٢١﴾ وَلَمَّا رَاَ الْمُؤْمِنُونَ الْاَحْزَابَۙ قَالُوا هٰذَا مَا وَعَدَنَا اللّٰهُ وَرَسُولُهُ وَصَدَقَ اللّٰهُ وَرَسُولُهُ
وَمَا زَادَهُمْ اِلَّا اٖيمَانًا وَتَسْلٖيمًاۜ ﴿٢٢﴾ مِنَ الْمُؤْمِنٖينَ رِجَالٌ صَدَقُوا مَا عَاهَدُوا اللّٰهَ عَلَيْهِۚ

---

(يَوَدُّوا لَوْ اَنَّهُمْ بَادُونَ فِي الْاَعْرَابِ يَسْئَلُونَ عَنْ اَنْبَٓائِكُمْ) - **o vaxt bu münafiqlər qorxularından istəyərdilər ki, kaş sizin aranızda olmayıb səhrada bədəvi ərəblər arasında olub, gedib-gələnlərdən sizin xəbərlərinizi soruşaydılar.**

(وَلَوْ كَانُوا فٖيكُمْ مَا قَاتَلُوٓا اِلَّا قَلٖيلًا) - **Halbuki əgər o münafiqlər sizin aranızda olarkən savaş olsa, o vaxt da ancaq az bir miqdar və riya səbəbi ilə savaşarlar.**

**21)** (لَقَدْ كَانَ لَكُمْ فٖي رَسُولِ اللّٰهِ اُسْوَةٌ حَسَنَةٌ) - **Həqiqətən, siz müsəlmanlar, gərək, Allahın Rəsuluna gözəl şəkildə tabe olub onu təqlid edib islam dininə kömək edəsiniz, necə ki Allahın Rəsulu özü səbir edib savaşdan heç bir tərəfə qaçmır.** (Uhud savaşında başı və dişləri sınıb üzü yaralandı). **Siz də gərək cihad etməkdə ona tabe olub sabit və möhkəm olasınız.** (لِمَنْ كَانَ يَرْجُوا اللّٰهَ وَالْيَوْمَ الْاٰخِرَ وَذَكَرَ اللّٰهَ كَثٖيرًا) - **Sizlərdən o şəxs ki, Allah-Təalanın rəhmətini, axirət günündə nicat tapmağı çox istəsə, Allah-Təalaya çox itaət və ibadət edib, gərək Allah Rəsuluna da tabe olub onun kimi cihad etməkdə möhkəm olsun.**

**22)** (وَلَمَّا رَاَ الْمُؤْمِنُونَ الْاَحْزَابَ) - **O zaman ki möminlər** (Qüreyş və Qətəfan camaatını) **o çoxluqda onların üstünə gəldiyini gördülər,** (قَالُوا هٰذَا مَا وَعَدَنَا اللّٰهُ وَرَسُولُهُ وَصَدَقَ اللّٰهُ وَرَسُولُهُ) - **dedilər ki, Allah-Təala və onun peyğəmbəri Məhəmmədin bizə vəd etdiyi bəla və müsibət budur ki, bizə yetişir. Allah-Təala və onun peyğəmbəri vədlərində sadiqdirlər, onların vədində xilaf olmaz. Gərək, indi biz səbir edək ki, mükafata yetişək.** (Ənkəbut surəsinin əvvəlində Allah-Təala möminlərə buyurur: "Bəs siz elə güman edirsiniz ki, sizlərə heç bir bəla və müsibət gəlməz, zəhmətsiz cənnətə daxil olacaqsınız, əlbəttə, sizə bəla və müsibət gələcəkdir. Necə ki sizdən əvvəl gələn ümmətlərə gəldi. O vaxt, gərək, səbir edəsiniz). Bu mübarək ayədə möminlərin sözləri bu mətləbə işarədir ki, Allah-Təala və peyğəmbərin vədi doğru olub bizə bəla və müsibət gəldi, indi səbir vaxtıdır). (وَمَا زَادَهُمْ اِلَّا اٖيمَانًا وَتَسْلٖيمًا) - **Möminlərə gələn bəla və müsibət onlardan ötrü Allah-Təalanın vədinə imanlarını, qəza və qədərə itaətlərini artırar.**

**23)** (مِنَ الْمُؤْمِنٖينَ رِجَالٌ صَدَقُوا مَا عَاهَدُوا اللّٰهَ عَلَيْهِ) - (Allahın Rəsulunun səhabəsindən neçə nəfər nəzir etdi ki, əgər cihada getsələr, şəhid olub oradan qayıtmasınlar, ya da ki, fəth edib qalib olsunlar, bu mübarək ayə onların haqqında gəlib).

فَمِنْهُمْ مَنْ قَضٰى نَحْبَهُ وَمِنْهُمْ مَنْ يَنْتَظِرُ وَمَا بَدَّلُوا تَبْدِيلًا ﴿٢٣﴾ لِيَجْزِيَ اللّٰهُ الصَّادِقِينَ بِصِدْقِهِمْ
وَيُعَذِّبَ الْمُنَافِقِينَ اِنْ شَٓاءَ اَوْ يَتُوبَ عَلَيْهِمْ اِنَّ اللّٰهَ كَانَ غَفُورًا رَحِيمًا ﴿٢٤﴾ وَرَدَّ اللّٰهُ الَّذِينَ كَفَرُوا
بِغَيْظِهِمْ لَمْ يَنَالُوا خَيْرًا وَكَفَى اللّٰهُ الْمُؤْمِنِينَ الْقِتَالَ وَكَانَ اللّٰهُ قَوِيًّا عَزِيزًا ﴿٢٥﴾ وَاَنْزَلَ الَّذِينَ
ظَاهَرُوهُمْ مِنْ اَهْلِ الْكِتَابِ مِنْ صَيَاصِيهِمْ وَقَذَفَ فِي قُلُوبِهِمُ الرُّعْبَ فَرِيقًا تَقْتُلُونَ وَتَأْسِرُونَ فَرِيقًا
﴿٢٦﴾ وَاَوْرَثَكُمْ اَرْضَهُمْ وَدِيَارَهُمْ وَاَمْوَالَهُمْ وَاَرْضًا لَمْ تَطَؤُهَا وَكَانَ اللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرًا ﴿٢٧﴾

---

**Buyurur: "Möminlərdən bəziləri vardır ki, Allah-Təalaya verdikləri sözə və nəzirlərinə vəfa etdilər. (فَمِنْهُمْ مَنْ قَضٰى نَحْبَهُ) - Onlardan bəzisi sözlərinə vəfa edib şəhidliyə yetişdi.** (Həmzə və Musab İbn Umeyr kimi şəxslər). **(وَمِنْهُمْ مَنْ يَنْتَظِرُ) - Səhabədən bəzisi də şəhid olmaq üçün intizar çəkirlər ki, bundan sonra şəhid olsunlar. (وَمَا بَدَّلُوا تَبْدِيلًا) - əhdlərini heç vaxt pozmazlar.**

**24) (لِيَجْزِيَ اللّٰهُ الصَّادِقِينَ بِصِدْقِهِمْ) - Onlar əhdlərinə vəfalı olub sadiq oldular, ki, Allah-Təala onların sidq və vəfalarına görə onlara xeyirli qarşılıq versin. (وَيُعَذِّبَ الْمُنَافِقِينَ اِنْ شَٓاءَ اَوْ يَتُوبَ عَلَيْهِمْ) - Və münafiqlərə** (tövbə etməyənlərə) **istəsə əzab edər, (اِنَّ اللّٰهَ كَانَ غَفُورًا رَحِيمًا) - həqiqətən, Allah-Təala tövbə edənlərə rəhm edib bağışlayandır.**

**25) (وَرَدَّ اللّٰهُ الَّذِينَ كَفَرُوا بِغَيْظِهِمْ لَمْ يَنَالُوا خَيْرًا) - Allah-Təala kafir olan Qüreyş və Qətəfan camaatını heç bir xeyrə çatmayan və acıqlı bir halda sizdən uzaqlaşdırdı. (وَكَفَى اللّٰهُ الْمُؤْمِنِينَ الْقِتَالَ) - Allah-Təala möminlərdən ötrü savaşda kifayət edər, özü onlara nicat verdi. (وَكَانَ اللّٰهُ قَوِيًّا عَزِيزًا) - Allah-Təala qüvvət sahibi kafirlərə qalib olub onlardan intiqam alandır.**

**26) (وَاَنْزَلَ الَّذِينَ ظَاهَرُوهُمْ مِنْ اَهْلِ الْكِتَابِ مِنْ صَيَاصِيهِمْ) - Kitab əhlindən o şəxslər ki,** (Bəni Qüreyzə) **Qüreyş camaatına kömək olub əhdlərini pozdular, Allah-Təala onları möhkəm qalalarından endirib siz müsəlmanları onlara hakim etdi. Bu mübarək ayə Bəni-Qüreyzə əhvalatına işarədir. Necə ki daha əvvəl bəhs edildi. (وَقَذَفَ فِي قُلُوبِهِمُ الرُّعْبَ) - Onların qəlblərinə Allah-Təala qorxu saldı. (فَرِيقًا تَقْتُلُونَ) - Onlardan bir qrupu** (yaramaz və fəsadçıları) **öldürdünüz, (وَتَأْسِرُونَ فَرِيقًا) - onlardan bir digər qrupu əsir etdiniz.**

**27) (وَاَوْرَثَكُمْ اَرْضَهُمْ وَدِيَارَهُمْ وَاَمْوَالَهُمْ) - Allah-Təala siz müsəlmanlara onların yerlərini, evlərini və mallarını miras verdi. Hamısına malik oldunuz. O səbəbə görə ki, onlar əhdi pozub, davam etdirməyib, zalım oldular. (وَاَرْضًا لَمْ تَطَؤُهَا) - Bir də Allah-Təala siz müsəlmanlara onları miras verdi ki, onlara sizin ayaqlarınız dəyməyibdir. Bundan sonra onları fəth edəcəksiniz.** (Allah-Təalanın bu vədi doğru olub müsəlmanların ayaqları dəyməyən yerləri Rum, fars, Yəmən, Afrika məmləkətlərini fəth etdilər. **(وَكَانَ اللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرًا) - Allah-Təala hər bir şeyə qadirdir.** (Bundan sonra gələn bir neçə ayə Allah Rəsulunun iffətli xanımları haqqında gəlibdir. Allah

يَآ اَيُّهَا النَّبِيُّ قُلْ لِاَزْوَاجِكَ اِنْ كُنْتُنَّ تُرِدْنَ الْحَيٰوةَ الدُّنْيَا وَزِينَتَهَا فَتَعَالَيْنَ اُمَتِّعْكُنَّ وَاُسَرِّحْكُنَّ سَرَاحًا جَمِيلًا

﴿٢٨﴾ وَاِنْ كُنْتُنَّ تُرِدْنَ اللّٰهَ وَرَسُولَهُ وَالدَّارَ الْاٰخِرَةَ فَاِنَّ اللّٰهَ اَعَدَّ لِلْمُحْسِنَاتِ مِنْكُنَّ اَجْرًا عَظِيمًا﴿٢٩﴾

---

Rəsulunun xanımları peyğəmbərdən daha çox var-dövlət istədilər. Hansı ki Allah Rəsulunun o şeyləri onlara verməyə imkanı yox idi. Peyğəmbər onlardan inciyib and içdi ki, 1 ay onlara yaxın getməsin, Allahın Rəsulu evdə əyləşib kənara çıxmadı. Xanımları haqqında düşündü. Səhabə arasında Allah Rəsulunun xanımlarını boşaması söz-söhbəti yayıldı. Ömər dedi: "Mən sizdən ötrü xəbər gətirərəm". Özünün qızı peyğəmbərin xanımı olduğu üçün iztiraba düşdü. Allah Rəsulu heç kimə yanına daxil olmağa izin vermirdi. Ömər gedib izin istədi, izin verilmədi. İkinci, üçüncü dəfə icazə istədikdən sonra axırda izin verildi. Allah Rəsulunun hüzuruna daxil olub soruşdu: "Ey peyğəmbər, xanımlarını boşamısan?" Buyurdu ki, yox, talaq verməmişəm. Ömər çıxıb səhabəyə xəbər verdi. O vaxt növbəti ayə onları talaqla evlilik arasında sərbəst buraxdı. Allah Rəsulu Aişədən başlayıb ayəni ona oxuyub onu getməklə qalmaq arasında sərbəst buraxdı. Aişə peyğəmbəri seçib talaq istəmədi. Fərəh və sevinc peyğəmbərin üzündə zahir oldu. Ondan sonra Allah Rəsulunun digər xanımları da ona tabe olub, talaq istəməyib peyğəmbəri seçdilər. Necə ki növbəti ayə xəbər verir).

**28) (يَآ اَيُّهَا النَّبِيُّ قُلْ لِاَزْوَاجِكَ) - Ey peyğəmbər, səndən artıq var-dövlət istəmək barəsində xanımlarına de ki, (اِنْ كُنْتُنَّ تُرِدْنَ الْحَيٰوةَ الدُّنْيَا وَزِينَتَهَا) - əgər siz dünyanın həyat və zinətini, yaxşı şeylərini istəyirsinizsə, məndə o şeylər yoxdur, (فَتَعَالَيْنَ اُمَتِّعْكُنَّ وَاُسَرِّحْكُنَّ سَرَاحًا جَمِيلًا) - gəlin sizə gözəl şəkildə zərəri olmayan bir şey verim, talaq verim gedin.**

**29) (وَاِنْ كُنْتُنَّ تُرِدْنَ اللّٰهَ وَرَسُولَهُ وَالدَّارَ الْاٰخِرَةَ) - Amma əgər Allah-Təala və onun peyğəmbərini axirət evini istəyib boşanmasanız, (فَاِنَّ اللّٰهَ اَعَدَّ لِلْمُحْسِنَاتِ مِنْكُنَّ اَجْرًا عَظِيمًا) - həqiqətən, Allah-Təala siz peyğəmbər xanımlarının yaxşı əməl sahiblərindən ötrü** (səbir edib talaq istəməyənlərdən ötrü) **böyük mükafat və savab axirətdə hazır edibdir.** (Allah Rəsulu bu ayəni əvvəlcə Aişəyə oxuyanda buyurdu: "Ey Aişə, cavab verməkdə tələsmə, valideynlərinlə məşvərət et", ayəni oxuyandan sonra Aişə dedi: "Ey peyğəmbər, səni seçmək üçün mən valideynlərimlə məşvərət edim? Əlbəttə mən Allah-Təala və onun peyğəmbərini seçib talaq istəmirəm. Amma ry peyğəmbər, səndən xahiş edirəm, mənim sözümü digər xanımlarına xəbər vermə. (Qadınlar arasında, xüsusən, günülərdə bir-birini qısqanmaq təbii şeydir). Allahın Rəsulu buyurdu: "Əgər məndən soruşsalar ki, Aişə nə cavab verdi, o vaxt məcbur qalıb, gərək, deyəm. Ondan sonra peyğəmbər ayəni digər xanımlarına da oxuyanda Aişənin cavabını soruşdular. Allahın Rəsulu da onlara xəbər verdi, onlar da hamısı Aişə kimi peyğəmbəri seçdilər. Necə ki daha əvvəl bəhs olundu).

يَا نِسَآءَ النَّبِيِّ مَنْ يَأْتِ مِنْكُنَّ بِفَاحِشَةٍ مُبَيِّنَةٍ يُضَاعَفْ لَهَا الْعَذَابُ ضِعْفَيْنِ وَكَانَ ذٰلِكَ عَلَى اللّٰهِ يَسِيرًا
﴿٣٠﴾ وَمَنْ يَقْنُتْ مِنْكُنَّ لِلّٰهِ وَرَسُولِهِ وَتَعْمَلْ صَالِحًا نُؤْتِهَآ اَجْرَهَا مَرَّتَيْنِ وَاَعْتَدْنَا لَهَا رِزْقًا كَرِيمًا
﴿٣١﴾ يَا نِسَآءَ النَّبِيِّ لَسْتُنَّ كَاَحَدٍ مِنَ النِّسَآءِ اِنِ اتَّقَيْتُنَّ فَلَا تَخْضَعْنَ بِالْقَوْلِ فَيَطْمَعَ الَّذِي فِي قَلْبِهِ
مَرَضٌ وَقُلْنَ قَوْلًا مَعْرُوفًا ﴿٣٢﴾

---

**30) (يَا نِسَآءَ النَّبِيِّ مَنْ يَأْتِ مِنْكُنَّ بِفَاحِشَةٍ مُبَيِّنَةٍ) - Ey peyğəmbər xanımları, sizdən hər hansı biri açıq-aşkar bir çirkin əməl** (böyük günah) **etsə, (يُضَاعَفْ لَهَا الْعَذَابُ ضِعْفَيْنِ) - özgə qadınlara bir günaha bir əzab verilər, amma sizdən ötrü iki qat əzab olar. (وَكَانَ ذٰلِكَ عَلَى اللّٰهِ يَسِيرًا) - Siz peyğəmbər xanımlarına iki qat əzab etmək Allah-Təala üçün asandır. Peyğəmbər xanımı olmağınız sizdən əzabı yox etməz, bəlkə, daha çox əzab edilməsinə səbəb olar.**

**31) (وَمَنْ يَقْنُتْ مِنْكُنَّ لِلّٰهِ وَرَسُولِهِ وَتَعْمَلْ صَالِحًا نُؤْتِهَآ اَجْرَهَا مَرَّتَيْنِ وَاَعْتَدْنَا لَهَا رِزْقًا كَرِيمًا) - Peyğəmbərin xanımlarından kim Allah-Təala və onun peyğəmbərinə itaət edib gözəl əməllər etsə, onun mükafatını iki dəfə verib və ondan ötrü axirətdə yaxşı ruzilər hazır etmişik.**

**32) (يَا نِسَآءَ النَّبِيِّ لَسْتُنَّ كَاَحَدٍ مِنَ النِّسَآءِ اِنِ اتَّقَيْتُنَّ) - Ey peyğəmbərin xanımları, əgər siz təqva** (dindarlıq) **edib Allah-Təala və onun peyğəmbərinə itaət etsəniz, siz digər qadınlar kimi deyilsiniz. Allah-Təala yanında fəzilət və dərəcədə qadınlardan heç kim sizə çata bilməz. (فَلَا تَخْضَعْنَ بِالْقَوْلِ فَيَطْمَعَ الَّذِي فِي قَلْبِهِ مَرَضٌ) - Kişilərlə danışanda, onlarla xəbis qadınlar kimi naz-qəmzə ilə danışmayın, o vaxt qəlbində fəsad olan şəxs sizə tamah salıb bəd xəyala düşər, (وَقُلْنَ قَوْلًا مَعْرُوفًا),- bəlkə, adət-ənənə üzrə onlarla danışın ki, sizə tamah salmasınlar.** (Allah-Təala bu mübarək ayədə qadınlara kişilərlə danışmağı qadağan etmir, çünkü onlar da insandırlar, ola bilər ki, ehtiyacları olsun, zəruri hallarda insanın danışmağa ehtiyacı olur, onlara da insanlarla münasibət qurmaq lazımdır, lakin yad kişilərin tamah salmasına səbəb olan danışma tərzini qadağan edir, hərçənd ayə peyğəmbərin xanımları barəsindədir, amma hökmü cəmi müsəlman qadınlarına aiddir. Əlbəttə, qadınlar, gərək, iffətli olub yad kişilərlə danışanda adət-ənənə üzrə danışıb, onlarla çirkin və batil, lazımsız sözləri danışmasınlar. Qızların barəsində ata və anaya ilk lazım olan şey ayənin məzmununa uyğun şəkildə islam qanunları ilə onlara iffət və isməti təlim etmək, çirkin əməl sahibi digər qadın cəmiyyətlərinin arasına daxil olmağı, onlar kimi əxlaqsız olmağı qadağan etmək lazım və vacibdir, amma islam dinində yaşamaq üçün lazım olan faydalı əməllərlə məşğul olmaq qadınlara qadağan edilməmişdir. İslam dinindən əvvəl cahiliyyət zamanında, xüsusən ərəb tayfalarında qadın heç bir qiymətə malik deyildi. İslam şəriətinin sahibi uca peyğəmbərimiz qadınları zillət və rəzillikdən xilas edib, onlara böyük haqlar verib, hər işdə kişilərlə onları bərabər sayıbdır. Qurani-Şərifdə onların hüququ barəsində varid olan açıq-aydın ayələr bu mətləbə böyük şahiddir.)

وَقَرْنَ فِي بُيُوتِكُنَّ وَلَا تَبَرَّجْنَ تَبَرُّجَ الْجَاهِلِيَّةِ الْاُولٰى وَاَقِمْنَ الصَّلٰوةَ وَاٰتِينَ الزَّكٰوةَ وَاَطِعْنَ اللّٰهَ وَرَسُولَهُ اِنَّمَا يُرِيدُ اللّٰهُ لِيُذْهِبَ عَنْكُمُ الرِّجْسَ اَهْلَ الْبَيْتِ وَيُطَهِّرَكُمْ تَطْهِيرًا ﴿٣٣﴾ وَاذْكُرْنَ مَا يُتْلٰى فِي بُيُوتِكُنَّ مِنْ اٰيَاتِ اللّٰهِ وَالْحِكْمَةِ

**33) (وَقَرْنَ فِي بُيُوتِكُنَّ وَلَا تَبَرَّجْنَ تَبَرُّجَ الْجَاهِلِيَّةِ الْاُولٰى) - Ey peyğəmbər xanımları, evinizdə oturub ev işləri ilə məşğul olun, amma çölə çıxarkən islamdan əvvəl cahiliyyət zamanındakı kimi özünüzə zinət verib kişilərdən ötrü özünüzü göstərməyin. (وَاَقِمْنَ الصَّلٰوةَ وَاٰتِينَ الزَّكٰوةَ وَاَطِعْنَ اللّٰهَ وَرَسُولَهُ) - Namaz qılıb, zəkat verib Allah-Təala və onun peyğəmbərinə itaət edin. (اِنَّمَا يُرِيدُ اللّٰهُ لِيُذْهِبَ عَنْكُمُ الرِّجْسَ اَهْلَ الْبَيْتِ وَيُطَهِّرَكُمْ تَطْهِيرًا) - Həqiqətən, Allah-Təalanın iradəsi odur ki, hər bir günahın pisliyini peyğəmbərin siz əhli-beytindən aparıb sizi pak və pakizə etsin.**

(Bu mübarək ayə Allah Rəsulunun bütün əhli-beytinə aiddir, gərək hamısı çirkin əməllərin pisliyindən uzaq və pak olsunlar. Lakin din alimi Əli ibn Məhəmməd ibn İbrahim Xazin öz təfsirində Əbu Səid Xudridən, o, tabeindən (səhabəni görənlər), onlar da səhabədən, o cümlədən Mücahid və Qətadədən və onlar da başqalarından nəql edib deyirlər: “Bu təthir” (paklanma) ayəsi Əli, Fatimeyi-Zəhra, Həsən və Hüseynə məxsusdur. Ondan sonra deyir: “Möminlərin anası Aişədən rəvayət olunan hədis bu mətləbə işarə edir. Aişə deyir: “Bir gün sabah vaxtı Allahın Rəsulu əynində naxışlı bir qara örtü ilə gəlib əyləşdi. O vaxt Fatimeyi-Zəhra da gəldi. Onu həmin örtüyə daxil etdi, ondan sonra Əli gəldi və onu da daxil etdi, ondan sonra Həsən gəldi, onu da daxil etdi, ondan sonra Hüseyn gəldi, onu da daxil edib “təthir” ayəsini oxudu”. Bu rəvayəti Müslüm “Səhih”də nəql edibdir. Ondan sonra Xazin deyir: “Ümmü Sələmədən rəvayət olunubdur, bu mübarək ayə mənim evimdə peyğəmbərə gəldi, mən qapı yanında əyləşmişdim, dedim: “Ey peyğəmbər, bəs mən əhli-beytdən deyiləm?” Buyurdu: “Sən xeyir əhli və peyğəmbərin xanımlarındansan”. O vaxt Əli, Fatimeyi-Zəhra, Həsən və Hüseyn mənim evimdə idilər, Allahın Rəsulu onları bir örtünün altına yığıb dedi: “İlahi, mənim əhli-beytim bunlardır, hər bir pisliyi bunlardan götürüb, bunları pak və pakizə et”. Bu hədisi (Tirmizi) nəql edib deyir: “Səhih” (doğru) və “qərib” (bir nəfər tərəfindən nəql edilən) bir hədisdir. Əllamə Xazinin sözü bitdi). Doğrudur, bu hədisləri mötəbər “ravi”lər (rəvayət edənlər) nəql edib təsdiq ediblər, lakin mübarək ayəni hədislərlə qarşılaşdıranda beş pak nur haqqında peyğəmbərin xüsusi hüsn-rəğbəti hədislərdən məlum olub ayənin ehtivası içində olduğu görünür, ayənin əvvəlini və sonunu düşünmək lazımdır).

**34) (وَاذْكُرْنَ مَا يُتْلٰى فِي بُيُوتِكُنَّ مِنْ اٰيَاتِ اللّٰهِ وَالْحِكْمَةِ) - Ey peyğəmbərin əhli-beyti, sizin evlərinizdə oxunan Allah-Təalanın ayələrini və hikmətini yadınıza salıb sizə vəhylə xitab edildiyini unutmayın. (اِنَّ اللّٰهَ كَانَ لَطِيفًا خَبِيرًا) Həqiqətən, Allah-Təala hər bir şeyin həqiqətindən agah olub hikmət üzrə sizin üçün**

اِنَّ اللّٰهَ كَانَ لَطِيفًا خَبِيرًا ﴿٣٤﴾ اِنَّ الْمُسْلِمِينَ وَالْمُسْلِمَاتِ وَالْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ وَالْقَانِتِينَ
وَالْقَانِتَاتِ وَالصَّادِقِينَ وَالصَّادِقَاتِ وَالصَّابِرِينَ وَالصَّابِرَاتِ وَالْخَاشِعِينَ وَالْخَاشِعَاتِ وَالْمُتَصَدِّقِينَ
وَالْمُتَصَدِّقَاتِ وَالصَّٓائِمِينَ وَالصَّٓائِمَاتِ وَالْحَافِظِينَ فُرُوجَهُمْ وَالْحَافِظَاتِ وَالذَّاكِرِينَ اللّٰهَ كَثِيرًا
وَالذَّاكِرَاتِ اَعَدَّ اللّٰهُ لَهُمْ مَغْفِرَةً وَاَجْرًا عَظِيمًا ﴿٣٥﴾ وَمَا كَانَ لِمُؤْمِنٍ وَلَا مُؤْمِنَةٍ اِذَا قَضَى اللّٰهُ
وَرَسُولُهُ اَمْرًا اَنْ يَكُونَ لَهُمُ الْخِيَرَةُ مِنْ اَمْرِهِمْ وَمَنْ يَعْصِ اللّٰهَ وَرَسُولَهُ فَقَدْ ضَلَّ ضَلَالًا مُبِينًا ﴿٣٦﴾

---

**ehkamlarını bildiribdir.** (Əvvəlki ayələr peyğəmbərin əhli-beytinə və xanımlarına məxsus olduğuna görə, növbəti ayə bütün mömin kişi və qadınların sifətlərini bəyan edib onlardan ötrü təyin edilən mükafat və savabı xəbər verir).

**35) (اِنَّ الْمُسْلِمِينَ وَالْمُسْلِمَاتِ) -** (Ey Məhəmməd), **həqiqətən islam dininə itaət edib tabe olan kişi və qadınlar (وَالْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ) - Allah-Təala və onun peyğəmbərini və islam dinində vacib olan ehkamı təsdiq edən kişi və qadınlar, (وَالْقَانِتِينَ وَالْقَانِتَاتِ), - Allah-Təala və onun peyğəmbərinə həmişə itaətdə olub itaətdən çıxmayan kişilər və qadınlar, (وَالصَّادِقِينَ وَالصَّادِقَاتِ) -, hər bir sözlərində, əməllərində, niyyətlərində sadiq olan kişilər, qadınlar, (وَالصَّابِرِينَ وَالصَّابِرَاتِ) -, ibadət etməkdə, müsibətlərlə qarşılaşmaqda səbir edən kişilər və qadınlar, (وَالْخَاشِعِينَ وَالْخَاشِعَاتِ) - Allah-Təalaya itaət, ibadət edəndə qəlbləri, üzvləri mütəvazi olan kişilər, qadınlar, (وَالْمُتَصَدِّقِينَ وَالْمُتَصَدِّقَاتِ), - mallarının zəkatını verən kişilər və qadınlar, (وَالصَّٓائِمِينَ وَالصَّٓائِمَاتِ) - mübarək Ramazanda, ya da ki, haram əməl səbəbi ilə oruc tutan kişilər və qadınlar, (وَالْحَافِظِينَ فُرُوجَهُمْ وَالْحَافِظَاتِ) - cinsi orqanlarını zinadan qoruyan kişilər və qadınlar, (وَالذَّاكِرِينَ اللّٰهَ كَثِيرًا وَالذَّاكِرَاتِ) - Allah-Təalanı hər bir məqamda çox zikr edən kişilər və qadınlar üçün (اَعَدَّ اللّٰهُ لَهُمْ مَغْفِرَةً وَاَجْرًا عَظِيمًا) - Allah-Təala əfv olunmağı və böyük mükafat və savabı hazır edibdir.**

**36) (وَمَا كَانَ لِمُؤْمِنٍ وَلَا مُؤْمِنَةٍ اِذَا قَضَى اللّٰهُ وَرَسُولُهُ اَمْرًا اَنْ يَكُونَ لَهُمُ الْخِيَرَةُ مِنْ اَمْرِهِمْ) -*O zaman ki Allah-Təala, onun peyğəmbəri bir iş haqqında hökm etdilər, heç bir mömin kişi və qadından ötrü caiz deyil ki, Allah-Təala və peyğəmbərin əmr və rəyini qoyub öz əmr və rəylərinə tabe olsunlar. Əmr və rəy Allah-Təala və onun peyğəmbərinin əmridir. (وَمَنْ يَعْصِ اللّٰهَ وَرَسُولَهُ) - Kim, Allah-Təala və onun peyğəmbərinə asi olub, onların əmr və rəyindən başqa ayrıca əmr və rəy ixtira edib seçsə, (فَقَدْ ضَلَّ ضَلَالًا مُبِينًا) - həqiqətən, o şəxs aşkar olan zillətə düşübdür. (Allah Rəsulu bibisi Ümeymə ibn Əbdülmüttəlibin qızı Zeynəb ibn Cəhşı özünün azad etdiyi qul Zeyd ibn Harisəylə evləndirdi. Zeynəb Qüreyşdən idi, Zeyd isə qul olduğuna görə, Zeydə qarşı təkəbbür və lovğalıq edib onunla xoş rəftar etmirdi. Zeyd buna görə, bədbəxtliyə düçar olub səbri tükəndi. Peyğəmbərin hüzuruna gedib məsələni ona bildirdi: "Ey**

**peyğəmbər, Zeynəbi boşayıram". Allahın Rəsulu ona bunu qadağan etdi. Zeyd ikinci, üçüncü dəfə gedib bu məsələni yenə açıb boşamaqda inad etdi. Hərçənd peyğəmbər Zeydə Zeynəbi boşamamağı əmr etmişdi, lakin bəşər təbiətinin şərtinə görə, qəlbinə gəlmişdi ki, əgər Zeyd Zeynəbi boşasa, özü onunla evlənsin. Bu fikir peyğəmbərin qəlbindən keçmişdi. Bu məsələdə bir günah olmasa da, peyğəmbər Zeydə oğul deyə xitab etdiyi üçün onun boşadığı qadını almaq xalqın gözündə çirkin bir iş sayıldığı üçün o mətləbi qəlbində saxlayıb bildirmədi. O vaxt bu ayə gəldi:** (Ey Məhəmməd), **Zeynəbi səninlə evləndirdik ki, möminlər arasında oğul deyilən şəxsin boşadığını almaq haram sayılmasın. Bu, ayədə bildirildi, necə ki bəhs olunacaq.**

*(*Qeyd:* *"Mübarək ayə Qurani-Şərifdə xəbər verilən ehkamın və peyğəmbərin hədislərində göstərilən qanunun xilafına rəy verənlərin həmişəlik həlakına və əbədi əzaba düçar olacaqlarına işarədir, halbuki bu dövrdə Quran və hədislərin xilafına rəy verənlər xalq arasında möhtərəm imam və rəhbər sayılıb, Quranın hökmünü bildirənlər zəlil, pərişan və dəyərsiz olublar. Elə deyil ki, avam camaat, həqiqətən, "Quran"ın xilafını istəyib Quranın ehkamından uzaqlaşıblar, bəlkə, islam dininin yolunu kəsənlər, islam milləti arasına fəsad salıb, təfriqəyə bais olub şəriəti pozanlar Quranın xilafını xalqın nəzərində Quran hökmündə göstərib avam xalq da kor-koranə onlara tabe olub, onları Allah Rəsulunun vəkili hesab edib, dinlərini onlara tapşırıb doğru yoldan kənar düşüblər. İlahi, belə cəhalət olarmı? Qurani-Şərifin bir hökmünü xalqa bəyan edəndə böyük, kiçik, rəis, işçi, hamısı diksinib, bizə ata-baba yolundan və onlardan qəbul etdiyimiz adətlərdən başqa, heç bir şey lazım deyildir, çığırtısını qoparırlar və o hökmü deyəni rəy sahiblərini küfrə, zındıqlığa isnad edirlər, bu zəmanə zahirdə islam, əslində, böyük cəhalət zamanıdır. Bağdadın fəqihləri (hüquqçuları) "icma" (ittifaq) edib, Həllac Mənsurun küfrünə hökm verdilər, onu tutub qətlinə hökm verdilər. Mənsur üzünü fəqihlərə tutub dedi: "Ey cənablar, niyə mənim qanımı halal bilib, qətlimə fitva verirsiniz, mənim dinim islam, kitabım Quran, peyğəmbərim Məhəmməd (s.a.v.), qibləm Kəbə, hansı səbəbdən məni kafir sayıb qətlimə hökm verirsiniz?" O cənablar əsla ona cavab verməyib qətl fərmanını yazıb hökumətə verdilər, ondan sonra o kişini bir baş kəsənə (qəssaba) təslim edib dedilər: "Aparıb bunu qətl et, sənə nə desə qulaq vermə", baş cəllad onu götürüb Bağdad çayının kənarına getdi, istədi onu qətl etsin, Mənsur dedi: "Gəl sənə bir nəsihət edim, mənim o nəsihətim Konstantinopolu (İstanbul) fəth etməyə bərabərdir". Cəllad dedi: "Mənə deyiblər ki, bu sözlərə qulaq verməyim". Onun əllərini kəsdi, Mənsur əlinin qanını üzünə sürtdü ki, birdən onun qətlinə fətva verən Allah-Təala düşmənləri din yolunda öldürülən vaxt onun rəngini saralmış görərlər. Allah ona böyük rəhmət etsin. O zaman səltənət və hökumət zalımların əlində olduğuna görə islam dininin düşmənləri çoxalıb, o zalımlarla eyni dindən*

وَاِذْ تَقُولُ لِلَّذٖيٓ اَنْعَمَ اللّٰهُ عَلَيْهِ وَاَنْعَمْتَ عَلَيْهِ اَمْسِكْ عَلَيْكَ زَوْجَكَ وَاتَّقِ اللّٰهَ وَتُخْفٖي فٖي نَفْسِكَ مَا اللّٰهُ مُبْدٖيهِ وَتَخْشَى النَّاسَ ۚ وَاللّٰهُ اَحَقُّ اَنْ تَخْشٰيهُ ۜ فَلَمَّا قَضٰى زَيْدٌ مِنْهَا وَطَرًا زَوَّجْنَاكَهَا لِكَيْ لَا يَكُونَ عَلَى الْمُؤْمِنٖينَ حَرَجٌ فٖيٓ اَزْوَاجِ اَدْعِيَٓائِهِمْ اِذَا قَضَوْا مِنْهُنَّ وَطَرًاۜ

---

*və eyni məzhəbdən olduqlarına görə, Allahın endirdiklərinin xilafına hökm verib, o möhtərəm şəxsin qətlinə fitva verdilər, Mənsurun, hətta ondan da böyük, alimənsəb islam böyüklərinin qətlinə fitva verib arzularına çatdılar. Hərçənd bu zamanda da səltənət və hökumətlərin əksəriyyəti ədalət və insafdan uzaqdırlar, lakin açıq-aşkar elə zülmləri yerinə yetirə bilmədiklərindən onların əlləri bağlanıb elə fitva verməkdən geri qalıblar. Əgər hökumətlər keçmiş zamanların hökuməti kimi olsaydı, keçmiş zamanın müftiləri kimi bu zamanda da elələri tapılıb əvvəlkilərdən artıq Quran əhlinin küfr və qətlinə fitva verərdilər. İslam ümmətinin ilk dövrlərindən sonra itirdiyi ağıl və müdriklik, sanki, bu zamanda yenidən peyda olub meydana çıxıbdır və bu səbəbdən yavaş-yavaş islam dininin həqiqətinə, Qurani-Şərifin ehkamına və o düşmənlərin məkr, hiylələrinə agah olma şüuru bəzi müsəlmanlarda müşahidə olunur. Onun səbəbi islam ümməti arasında bəzi elm və kamal sahibi olan din dəvətçilərinin mədəniyyət üfüqündən doğulub elm nuru ilə onları aydınlatmasıdır. Əgər indi bundan sonra islam ümməti içində maarifin tərəqqisini istəsək, necə olur-olsun, gərək, o istək reallaşa, qələmi saxlayıb islam düşmənlərinin nə qədər, necə və hansı libasda olmalarını baxanların diqqətli baxışlarla anlamasına həvalə etdim, hidayəti verən Allahdır).*

**37) (وَاِذْ تَقُولُ لِلَّذٖيٓ اَنْعَمَ اللّٰهُ عَلَيْهِ وَاَنْعَمْتَ عَلَيْهِ اَمْسِكْ عَلَيْكَ زَوْجَكَ وَاتَّقِ اللّٰهَ) - O zaman ki, sən dedin** (ey Məhəmməd), **o şəxsə ki** (Zeydə) **Allah-Təala İslam səbəbinə nemət verib, sən də ona nemət verib, onu azad edib, oğul deyə xitab edirdin – Allah-Təaladan çəkin, xanımını boşama. (وَتُخْفٖي فٖي نَفْسِكَ مَا اللّٰهُ مُبْدٖيهِ) - (Ey Məhəmməd), sən öz nəfsində və qəlbində gizlədirsən o şeyi ki,** (Zeynəbi almağı) **Allah-Təala onu aşkar edib sənə Zeynəblə evlənməyə əmr edəcəkdir. (وَتَخْشَى النَّاسَ ۚ وَاللّٰهُ اَحَقُّ اَنْ تَخْشٰيهُ) - Xalqdan qorxub qəlbindəkini aşkar etmirsən, halbuki Allah-Təaladan qorxmaq daha layiq və uyğundur. Xalqdan qorxmayıb qəlbindəki mətləbi ortaya çıxart. (فَلَمَّا قَضٰى زَيْدٌ مِنْهَا وَطَرًا زَوَّجْنَاكَهَا)** - (Ey Məhəmməd), **o zaman ki Zeydin Zeynəbə bir ehtiyacı qalmayıb, onu saxlamağa həvəsi tükənib, onu boşadı, biz onu səninlə evləndirdik.**

**(لِكَيْ لَا يَكُونَ عَلَى الْمُؤْمِنٖينَ حَرَجٌ فٖيٓ اَزْوَاجِ اَدْعِيَٓائِهِمْ اِذَا قَضَوْا مِنْهُنَّ وَطَرًاۜ) - Zeynəbi səninlə evləndirməkdən məqsəd odur ki, möminlərin oğul dedikləri şəxslər xanımlarını boşadıqları zaman, möminlərə onlarla evlənməkdə bir qarışıqlıq, bir günah olmasın. Bilsinlər ki, oğul deyilən şəxsin boşadığı xanımı ilə evlənmək islam şəriətində caizdir.**

وَكَانَ اَمْرُ اللّٰهِ مَفْعُولًا ﴿٣٧﴾ مَا كَانَ عَلَى النَّبِيِّ مِنْ حَرَجٍ فِيمَا فَرَضَ اللّٰهُ لَهُ ۗ سُنَّةَ اللّٰهِ فِي الَّذِينَ
خَلَوْا مِنْ قَبْلُ ۗ وَكَانَ اَمْرُ اللّٰهِ قَدَرًا مَقْدُورًاۙ ﴿٣٨﴾ اَلَّذِينَ يُبَلِّغُونَ رِسَالَاتِ اللّٰهِ وَيَخْشَوْنَهُ وَلَا يَخْشَوْنَ
اَحَدًا اِلَّا اللّٰهَ ۗ وَكَفٰى بِاللّٰهِ حَسِيبًا ﴿٣٩﴾ مَا كَانَ مُحَمَّدٌ اَبَٓا اَحَدٍ مِنْ رِجَالِكُمْ وَلٰكِنْ رَسُولَ اللّٰهِ وَخَاتَمَ
النَّبِيِّنَ ۗ وَكَانَ اللّٰهُ بِكُلِّ شَيْءٍ عَلِيمًا ۟ ﴿٤٠﴾ يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا اذْكُرُوا اللّٰهَ ذِكْرًا كَثِيرًاۙ ﴿٤١﴾ وَسَبِّحُوهُ
بُكْرَةً وَاَصِيلًا ﴿٤٢﴾

---

**(وَكَانَ اَمْرُ اللّٰهِ مَفْعُولًا) - Hər bir iş ki, Allah-Təala onun vaqe olmasını istəyirsə, o iş gərək, əlbəttə, vaqe olsun.**

**38) (مَا كَانَ عَلَى النَّبِيِّ مِنْ حَرَجٍ فِيمَا فَرَضَ اللّٰهُ لَهُ) - Bu peyğəmbərə** (Məhəmmədə) **Allah-Təalanın ondan ötrü qismət edib halal etdiyi nikahlarda heç bir günah yoxdur. (سُنَّةَ اللّٰهِ فِي الَّذِينَ خَلَوْا مِنْ قَبْلُ) Nikahın halal olmağı Allah-Təalanın qanunudur ki, keçmiş peyğəmbərlərdən ötrü də bu yolu təyin edib nikah etməyi onlara halal edibdir. Necə ki onlara halal edib, bu peyğəmbərə də halal edibdir. (وَكَانَ اَمْرُ اللّٰهِ قَدَرًا مَقْدُورًاۙ) Allah-Təalanın əmri sabit və təyin olunmuş bir qismətdir ki, heç bir şəxsə halal olunan şeylərdə günah yoxdur.**

**39) (اَلَّذِينَ يُبَلِّغُونَ رِسَالَاتِ اللّٰهِ وَيَخْشَوْنَهُ وَلَا يَخْشَوْنَ اَحَدًا اِلَّا اللّٰهَ) - Peyğəmbərlərin sifətlərindən biri də odur ki, Allah-Təalanın buyurduqlarını xalqa çatdırıb, ancaq Allah-Təaladan qorxub, ondan başqasından qorxmazlar. (وَكَفٰى بِاللّٰهِ حَسِيبًا) - Xalqın əməllərindən haqq-hesab çəkməyə Allah-Təala yalnız özü kifayət edər. Bir əlahiddə yoldaş ona lazım deyildir. Belə Allah-Təaladan qorxmaq lazımdır, nəinki ondan başqasından.** (Xalq peyğəmbərin Zeydin boşadığı xanımını almasını ona eyib sayıb dedilər: "Öz oğlunun arvadını aldı". Növbəti ayə onların bu sözünü rədd etmək üçün gəldi).

**40) (مَا كَانَ مُحَمَّدٌ اَبَٓا اَحَدٍ مِنْ رِجَالِكُمْ وَلٰكِنْ رَسُولَ اللّٰهِ وَخَاتَمَ النَّبِيِّنَ) - Bu Məhəmməd, sizin kişilərinizdən heç bir nəfərin, həqiqətən, atası deyildir. Bəlkə Allah-Təalanın peyğəmbəri və peyğəmbərlərin sonuncusudur ki, daha ondan sonra peyğəmbər gəlməyəcəkdir. Necə ki həqiqətən, sizin atanız deyildir, habelə Zeydin də, həqiqətən, atası deyildir. Amma peyğəmbər ümmətin tərbiyəçisi olduğu üçün islam ümmətinin atası səviyyəsindədir.** (Bu mətləbdə Zeyd və ya Zeyddən başqası fərq etməz). **Zeyd onun həqiqətən oğlu deyildir ki, onun boşadığını ala bilməsin. (وَكَانَ اللّٰهُ بِكُلِّ شَيْءٍ عَلِيمًا) - Allah-Təala hər bir şeydən agahdır. Bu peyğəmbərdən sonra peyğəmbərin olmaması da Allah-Təalanın elmi daxilindədir.**

**41-42) (يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا اذْكُرُوا اللّٰهَ ذِكْرًا كَثِيرًاۙ وَسَبِّحُوهُ بُكْرَةً وَاَصِيلًا) - Ey iman gətirən şəxslər, Allah-Təalaya çox həmd-səna edib, xüsusən, sübh vaxtı, bir də əsr namazı vaxtı (hansı ki vaxtların ən yaxşısıdır) Allah-Təalaya həmd-səna edin.**

هُوَ الَّذِي يُصَلِّي عَلَيْكُمْ وَمَلٰئِكَتُهُ لِيُخْرِجَكُمْ مِنَ الظُّلُمَاتِ اِلَى النُّورِ وَكَانَ بِالْمُؤْمِنِينَ رَحِيمًا ﴿٤٣﴾
تَحِيَّتُهُمْ يَوْمَ يَلْقَوْنَهُ سَلَامٌ وَاَعَدَّ لَهُمْ اَجْرًا كَرِيمًا ﴿٤٤﴾ يَآ اَيُّهَا النَّبِيُّ اِنَّآ اَرْسَلْنَاكَ شَاهِدًا وَمُبَشِّرًا
وَنَذِيرًا ﴿٤٥﴾ وَدَاعِيًا اِلَى اللّٰهِ بِاِذْنِهِ وَسِرَاجًا مُنِيرًا ﴿٤٦﴾ وَبَشِّرِ الْمُؤْمِنِينَ بِاَنَّ لَهُمْ مِنَ اللّٰهِ فَضْلًا
كَبِيرًا ﴿٤٧﴾

---

**43) (هُوَ الَّذِي يُصَلِّي عَلَيْكُمْ وَمَلٰئِكَتُهُ) - Allah-Təalanın lütfü və yardımı siz möminləri belə əhatə edir ki, həm özü sizə rəhmət göndərir və həm mələkləri sizdən ötrü əfv xahişi edirlər. (لِيُخْرِجَكُمْ مِنَ الظُّلُمَاتِ اِلَى النُّورِ) - Belə ki, siz möminləri cəhalət qaranlığından elm nuruna tərəf çıxardıb, sizi doğru yola hidayət etsin.** (İnsanlar arasında Allah-Təalaya ən yaxın şəxslər elm sahibləridir və bu səbəbdən Qurani-Şərifdə hər bir məqamda elm əhlini vəsf edib özünün müqəddəs varlığının elmə sahib olduğunu deyib, ikinci belə bir varlığın olmadığını bəyan buyurubdur). **(وَكَانَ بِالْمُؤْمِنِينَ رَحِيمًا) - Allah-Təalanın rəhməti möminləri ehtiva edir. Belə ki, zülmət cəhalətindən elm nuru tərəfinə çıxsınlar.**

**44) (تَحِيَّتُهُمْ يَوْمَ يَلْقَوْنَهُ سَلَامٌ) - Qiyamət günündə möminlər Allah-Təala ilə görüşən vaxt onlara edilən xeyir-dua Allah-Təala tərəfindən onlara salam göndərilməsidir. (وَاَعَدَّ لَهُمْ اَجْرًا كَرِيمًا) - Allah-Təala onlara salam göndərib, onlardan ötrü mükafat və savablar hazır edibdir.**

**(45-46) (يَآ اَيُّهَا النَّبِيُّ اِنَّآ اَرْسَلْنَاكَ شَاهِدًا وَمُبَشِّرًا وَنَذِيرًا وَدَاعِيًا اِلَى اللّٰهِ بِاِذْنِهِ وَسِرَاجًا مُنِيرًا) - Ey peyğəmbər, həqiqətən, biz səni öz tərəfimizdən qiyamət günündə xalqın yaxşı-yaman əməllərinə şahid olmağa və bizim rəhmətimizlə müjdələyib əzabımızdan qorxutmağa və Allah-Təalanın izni ilə onun tərəfinə xalqı dəvət etməyə və xalqın o dəvət səbəbi ilə haqq yola hidayət tapmağından ötrü səni bir nurani çıraq kimi göndərdik ki, bütün çıraqların nuru sənin çırağının müqabilində məhv və yox olsun.** Bugünkü günə kimi o cənabın çırağının nuru tərəqqidə və artmaqdadır. Hərçənd bu zamanda o çırağın nurunda bir az zəiflik müşahidə olunur, islam ümməti cəhalət və nadanlıq, tənbəllik səbəbi ilə o çırağı islah etməkdən aciz olub, zahirdə onun nurunda zəiflik görünsə də, o çırağın piltəsinin yağı ("Onun yağı az qala od olmasa da işıq verir") **elə bir okeana bağlıdır ki, əbədiyyən onun yağı tükənən deyildir. Nə vaxt ki Hz. Məhəmmədin o çırağı batini elm gücü ilə islah edilsə, onun şöləsi şərq, qərb aləminə ziya bəxş edib yer kürəsinə yayılacaqdır. İslam ümmətinə qeyrət və hərəkət lazımdır.**

**47) (وَبَشِّرِ الْمُؤْمِنِينَ بِاَنَّ لَهُمْ مِنَ اللّٰهِ فَضْلًا كَبِيرًا) - (Ey Məhəmməd), möminlərə müjdə ver ki, onlardan ötrü axirətdə əməllərinin savabından başqa Allah-Təaladan böyük mərhəmət və savab vardır.**

وَلَا تُطِعِ الْكَافِرِينَ وَالْمُنَافِقِينَ وَدَعْ اَذٰيهُمْ وَتَوَكَّلْ عَلَى اللّٰهِ ۜ وَكَفٰى بِاللّٰهِ وَكٖيلًا ﴿٤٨﴾ يَٓا اَيُّهَا
الَّذٖينَ اٰمَنُوٓا اِذَا نَكَحْتُمُ الْمُؤْمِنَاتِ ثُمَّ طَلَّقْتُمُوهُنَّ مِنْ قَبْلِ اَنْ تَمَسُّوهُنَّ فَمَا لَكُمْ عَلَيْهِنَّ مِنْ عِدَّةٍ
تَعْتَدُّونَهَاۚ فَمَتِّعُوهُنَّ وَسَرِّحُوهُنَّ سَرَاحًا جَمٖيلًا﴿٤٩﴾ يَٓا اَيُّهَا النَّبِيُّ اِنَّٓا اَحْلَلْنَا لَكَ اَزْوَاجَكَ الّٰتٖٓي
اٰتَيْتَ اُجُورَهُنَّ وَمَا مَلَكَتْ يَمٖينُكَ مِمَّٓا اَفَٓاءَ اللّٰهُ عَلَيْكَ وَبَنَاتِ عَمِّكَ

---

**48) (وَلَا تُطِعِ الْكَافِرِينَ وَالْمُنَافِقِينَ وَدَعْ اَذٰيهُمْ وَتَوَكَّلْ عَلَى اللّٰهِ)** - (Ey Məhəmməd), **kafir və münafiqlərin sözlərinə qulaq verməyib, onlara itaət etməkdə sabit və möhkəm olub, sənə etdikləri əziyyətdən üz çevirib, Allah-Təalaya təvəkkül et.**

**(وَكَفٰى بِاللّٰهِ وَكٖيلاً) - Allah-Təala sənin hər bir işinə vəkil olduğu halda sənə kifayət edər. Sənin Allah-Təaladan başqasına ehtiyacın yoxdur.**

**49) (يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوٓا اِذَا نَكَحْتُمُ الْمُؤْمِنَاتِ ثُمَّ طَلَّقْتُمُوهُنَّ مِنْ قَبْلِ اَنْ تَمَسُّوهُنَّ) - Ey iman gətirən şəxslər, mömin qadınlarla kəbin kəsdikdən sonra onlarla zifafa girmədən boşadınız, (فَمَا لَكُمْ عَلَيْهِنَّ مِنْ عِدَّةٍ تَعْتَدُّونَهَا) - o halda siz kişilərdən ötrü qadınlara "iddət" gözləmək** (yenidən ərə getmək üçün vaxt) **lazım deyildir ki, sizdən ötrü iddət saxlasınlar.** (Zifafa girilməmiş qadını boşamaq iki qisimdir. Birinci qisim odur ki, ondan ötrü mehriyyə (kəbin haqqı, başlıq) təyin edilibsə, talaq vaxtında təyin edilən mehriyyənin yarısı qadına çatar, ikinci qisim odur ki, kəbin müqaviləsində mehriyyə təyin edilməmiş olsun. Çünki mehriyyə təyin etmək kəbin müqaviləsinin doğruluğunun şərti deyil. Ola bilər ki, kişi və qadın kəbin kəsdirib müqavilədə mehriyyədən bəhs etməsinlər. Ondan sonra özləri öz aralarında bir mehriyyəyə qərar versinlər. Bu ikinci qismin hökmünü sıradakı ayədə bəyan buyurur). **(فَمَتِّعُوهُنَّ وَسَرِّحُوهُنَّ سَرَاحًا جَمٖيلًا) - Zifafa girilməyib mehriyyəsi təyin edilməyən qadınları boşayan zaman onlara bir şey verib, gözəl şəkildə onları yola salın.** (Bu ayə bu kimi boşanmış qadınlara bir şey verməyin vacib olmağına işarə edir, amma əgər mehriyyəsi verilməyən qadın zifafdan sonra boşanılsa, o vaxt onun kimi qadınların mehriyyəsi nə qədərdirsə, gərək, o qədər ona mehriyyə verilsin).

**50) (يَٓا اَيُّهَا النَّبِيُّ اِنَّٓا اَحْلَلْنَا لَكَ اَزْوَاجَكَ الّٰتٖٓي اٰتَيْتَ اُجُورَهُنَّ) - Ey peyğəmbər, o qadınlar ki, onlarla kəbin bağlayıb mehriyyələrini vermisən, o qadınları sənə halal etdik. (Bu kimi qadınlar necə ki, peyğəmbərə halaldır, habelə ümmətinə də halaldır. Amma bu ayədən bir mətləb də aydın olur, o qadın ki, əri onun mehriyyəsini verməyib, ya da ki, məqsədi verməmək olub, o qadın o şəxsə haramdır. Bu mətləb hədisdə də qeyd olunubdur. (وَمَا مَلَكَتْ يَمٖينُكَ مِمَّٓا اَفَٓاءَ اللّٰهُ عَلَيْكَ) - Bir də Allah-Təala cihadda qənimət kimi malik olduğun kənizləri sənə halal etdi, (وَبَنَاتِ عَمِّكَ) - əmin qızlarını da. Bir də Allah-Təala o qadınların qızları ilə kəbin bağlamağı sənə**

وَبَنَاتِ عَمَّاتِكَ وَبَنَاتِ خَالِكَ وَبَنَاتِ خَالَاتِكَ الّٰتِي هَاجَرْنَ مَعَكَۘ وَامْرَاَةً مُؤْمِنَةً اِنْ وَهَبَتْ نَفْسَهَا لِلنَّبِيِّ اِنْ اَرَادَ النَّبِيُّ اَنْ يَسْتَنْكِحَهَاۗ خَالِصَةً لَكَ مِنْ دُونِ الْمُؤْمِنِينَۜ قَدْ عَلِمْنَا مَا فَرَضْنَا عَلَيْهِمْ فٖيٓ اَزْوَاجِهِمْ وَمَا مَلَكَتْ اَيْمَانُهُمْ لِكَيْلَا يَكُونَ عَلَيْكَ حَرَجٌۜ وَكَانَ اللّٰهُ غَفُورًا رَحٖيمًا ﴿٥٠﴾ تُرْجٖي مَنْ تَشَٓاءُ مِنْهُنَّ وَتُـْٔوٖيٓ اِلَيْكَ مَنْ تَشَٓاءُۜ وَمَنِ ابْتَغَيْتَ مِمَّنْ عَزَلْتَ فَلَا جُنَاحَ عَلَيْكَۜ ذٰلِكَ اَدْنٰٓى اَنْ تَقَرَّ اَعْيُنُهُنَّ وَلَا يَحْزَنَّ وَيَرْضَيْنَ بِمَٓا اٰتَيْتَهُنَّ كُلُّهُنَّۜ

---

**halal etdi, hansı ki, (وَبَنَاتِ عَمَّاتِكَ) - xalan qızlarıdır, (وَبَنَاتِ خَالِكَ) - və dayın qızlarıdır, (وَبَنَاتِ خَالَاتِكَ) - və bibin qızlarıdır. (الّٰتِي هَاجَرْنَ مَعَكَ)** - (Ey Məhəmməd), **bəhs olunan qadınlardan hansı ki səninlə Mədinəyə hicrət etdilər, onlar sənə halaldır, hicrət etməyən müşrik qadınlar halal deyildir. (وَامْرَاَةً مُؤْمِنَةً اِنْ وَهَبَتْ نَفْسَهَا لِلنَّبِيِّ اِنْ اَرَادَ النَّبِيُّ اَنْ يَسْتَنْكِحَهَاۗ) - Yenə halaldır peyğəmbərə hər o mömin qadın ki Allahın Rəsulu onunla evlənmək istəyə və qadın da özünü peyğəmbərə bağışlaya, bu qadın özünü bağışlayarsa, peyğəmbərə halaldır, daha kəbin bağlamaq lazım deyil.** (Ey Məhəmməd), **bu, ancaq sənə halaldır, səndən başqa, heç bir şəxsə halal deyildir.** (İbn Abbas və Mücahid deyiblər: "Bağışlanma yolu ilə peyğəmbər heç kimlə evlənmədi"). **(قَدْ عَلِمْنَا مَا فَرَضْنَا عَلَيْهِمْ فٖيٓ اَزْوَاجِهِمْ وَمَا مَلَكَتْ اَيْمَانُهُمْۜ),- Həqiqətən, biz peyğəmbərdən başqa digərlərinin xanımlarının və kənizlərinin haqqında onlara vacib etdiyimiz hökmlərin hikmətinə agah olub, peyğəmbərlə onları bərabər saymadıq. (لِكَيْلَا يَكُونَ عَلَيْكَ حَرَجٌۜ)** - (Ey Məhəmməd), **bu qadınları sənə halal etdik ki, xanımların barəsində sənə bir çətinlik olmasın, bəlkə, hər bir qadını almaqda sənin üçün asan olsun. (وَكَانَ اللّٰهُ غَفُورًا رَحٖيمًا) - Allah-Təala günaha vaqe olanları tövbə edəndən sonra bağışlayıb onlara rəhm edəndir.** (İslam dinində kişilərdən ötrü qadınlar barəsində ədalətlə rəftar etmək lazımdır, əgər kişinin birdən artıq xanımı olsa, gərək, onların geyim-keçimində və gecə yanlarında qalmaqda ədalət üzrə rəftar etsin. Ancaq peyğəmbərdən ötrü Allah-Təala növbəti ayədə bu bəhs olunan işlərdə artıq-əksik hərəkət etməkdə ixtiyar verir. Bununla birlikdə, Allahın Rəsulu xanımlarının arasında ədalətlə rəftar edib hamısıyla eyni cür rəftar edirdi, ancaq xanımlarından Sevda Zəma qızı qoca olduğuna görə, gecəlik haqqını Aişəyə verdi).

**51) (تُرْجٖي مَنْ تَشَٓاءُ مِنْهُنَّ)** - (Ey Məhəmməd), **sənə ixtiyar verilir ki, xanımlarından hansını istəsən, onun yanına gedəsən və ya gecə yanında qalmayasan. (وَمَنِ ابْتَغَيْتَ مِمَّنْ عَزَلْتَ فَلَا جُنَاحَ عَلَيْكَ) - Hansını istəməyib özündən kənar edəsən, bunda sənə heç bir günah yoxdur, onlar üçün vaxtı bölüşdürmək sənə vacib deyildir. (ذٰلِكَ اَدْنٰٓى اَنْ تَقَرَّ اَعْيُنُهُنَّ وَلَا يَحْزَنَّ)** - (Ey Məhəmməd), **xanımların haqqında sənə bu ixtiyarın verilməsi onların gözlərinin işıqlanmağına səbəb olar. Bu ixtiyarın Allah-Təaladan olduğuna agah olduqlarında onların gözləri işıqlanıb daha hüznlü və qəmgin olmazlar. (وَيَرْضَيْنَ بِمَٓا اٰتَيْتَهُنَّ كُلُّهُنَّۜ) - Hamısına bəxş edib verdiyin şeylərə razı olub daha**

وَاللّٰهُ يَعْلَمُ مَا فٖي قُلُوبِكُمْ ۜ وَكَانَ اللّٰهُ عَلٖيمًا حَلٖيمًا ﴿٥١﴾ لَا يَحِلُّ لَكَ النِّسَٓاءُ مِنْ بَعْدُ وَلَٓا اَنْ تَبَدَّلَ بِهِنَّ مِنْ اَزْوَاجٍ وَلَوْ اَعْجَبَكَ حُسْنُهُنَّ اِلَّا مَا مَلَكَتْ يَمٖينُكَ ۜ وَكَانَ اللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ رَقٖيبًا ۟ ﴿٥٢﴾

---

**deməsinlər, nədən ötrü filana artıq, mənə əskik verdin. Çünki Allah-Təalanın əmrinə etiraz etmək olmaz,** (amma Allahın Rəsulu bu ixtiyara baxmayaraq həmişə xanımlarının arasında ədalət üzrə rəftar edirdi, buna görə də Allah-Təala o ixtiyarı ona bəxş etdi).

**(وَاللّٰهُ يَعْلَمُ مَا فٖي قُلُوبِكُمْ) - Allah-Təala sizin qəlblərinizdə xanımlarınız haqqında olan fikirlərə bələddir. (وَكَانَ اللّٰهُ عَلٖيمًا حَلٖيمًا) - Allah-Təala hər bir şeyə agahdır və günahkarın əzabını təxirə salandır.**

**52) (لَا يَحِلُّ لَكَ النِّسَٓاءُ مِنْ بَعْدُ) -** (Ey Məhəmməd)*, **bu 9 xanımından sonra daha sənə kəbinlə arvad almaq halal deyildir.**

**(وَلَٓا اَنْ تَبَدَّلَ بِهِنَّ مِنْ اَزْوَاجٍ وَلَوْ اَعْجَبَكَ حُسْنُهُنَّ اِلَّا مَا مَلَكَتْ يَمٖينُكَ) - və başqa qadınlar çox gözəl olub onların hüsn və görünüşü səni heyrətə salıb onlardan xoşlansan da, bu 9 xanımın hamısını, ya bəzisini boşayıb onların əvəzinə kəbinlə başqa qadın ala bilməzsən. Ancaq kənizi mülkiyyətlə özünə halal edə bilərsən, amma nikahla bu 9 qadından artıq almaq, ya da onları başqaları ilə əvəz etmək səndən ötrü caiz deyildir. (وَكَانَ اللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ رَقٖيبًا) - Allah-Təala hər bir şeyə həddini bildirən və nəzarət edəndir, əmr və qadağalarına əməl etməyənlərə əzab edəcəkdir. Allahın Rəsulu yemək yeyərkən, bir qrup icazəsiz daxil olub, yemək yeyib ondan sonra əyləşib söhbət etdilər, peyğəmbər onlara durun gedin deməyə həya edib, sakitcə dayanıb, əziyyət çəkirdi. O vaxt bu ayə gəldi.**

*(*__Qeyd:__ "Allah-Təala islam ümmətinə ədalət şərtilə 4 qadını halal etdiyi kimi peyğəmbərə də 9 qadını halal buyurdu. Allah Rəsulunu o 9 qadın arasında talaqla evlilik arasında seçim etməkdə sərbəst qoydu, necə ki həmin surədə bundan əvvəl bəhs olundu, Allah-Təala onların hörmətinə görə, bu mübarək ayədə onlardan artıq nikahla evlənməyi və ya onları əvəz etməyi peyğəmbərə haram buyurdu. O 9 qadın ki, peyğəmbərin xanımı olublar, bunlardır: 1) Ümmü Sələmə Bəni Ümeyyə qızı 2) Sevdə Zəma qızı 3) Aişə Əbu Bəkir qızı 4) Ümmü Həbibə Əbu Süfyan qızı 5) Həfsə Ömər qızı 6) Safiyə Huyey ibn Əxtab Xeybərinin qızı 7) Meymunə Haris Həlalinin qızı 8) Zeynəb Cəhş Əsədinin qızı 9) Cüveyriyə Haris Mustəliqinin qızı (Allah onlardan razı olsun). Bu 9 qadının hamısı həyatda ikən Allahın Rəsulu dünyadan köçdü, bu 9 qadının arasında bircə Aişəni bakirə ikən almışdı. Digərləri dul idilər, əksəriyyəti də yaşlı idilər Amma peyğəmbərin birinci möhtərəm xanımı möminlərin anası olan Xədicədir. İslamda ona heç bir qadın bərabər ola bilməz. Var-dövləti ilə islama edən xidməti çox böyükdür. Peyğəmbər o, həyatda ikən heç bir qa-*

يَٓا اَيُّهَا الَّذ۪ينَ اٰمَنُوا لَا تَدْخُلُوا بُيُوتَ النَّبِيِّ اِلَّٓا اَنْ يُؤْذَنَ لَكُمْ اِلٰى طَعَامٍ غَيْرَ نَاظِر۪ينَ اِنٰيهُۙ وَلٰكِنْ اِذَا دُع۪يتُمْ فَادْخُلُوا فَاِذَا طَعِمْتُمْ فَانْتَشِرُوا وَلَا مُسْتَأْنِس۪ينَ لِحَد۪يثٍۜ اِنَّ ذٰلِكُمْ كَانَ يُؤْذِي النَّبِيَّ فَيَسْتَحْي۪ مِنْكُمْۘ وَاللّٰهُ لَا يَسْتَحْي۪ مِنَ الْحَقِّۜ

---

*dınla evlənmədi. Allah Rəsulunun Xədicədən 3 oğlu, 4 qızı oldu. Oğlanları Teyyib, Tahir, Qasımdır. Peyğəmbərə oğlu Qasımın adı ilə ləqəb verib Əbül-Qasım (Qasımın atası) deyirdilər. Hər 3-ü uşaq ikən vəfat etdi. 4 qızı var idi. Birincisi Zeynəbdir. Allahın Rəsulu onu peyğəmbərliklə vəzifələndirilmədən əvvəl Məkkədə Əbul-As İbn Rəbiylə evləndirdi. Peyğəmbərlikdən sonra Əbul-As Allah Rəsuluna iman etmədi. Peyğəmbər Mədinəyə hicrət edəndə onunla şərt bağladı ki, Məkkədən qızı Zeynəbi Mədinəyə göndərsin. Əbul-As əhdinə vəfa edib Zeynəbi bir dəvəyə mindirib qardaşı Kinanə ilə Mədinəyə yola saldı. Zeynəb Mədinədə peyğəmbər hələ həyatda ikən vəfat etdi. 2-ci qızı Ruqiyədir. Məkkədə peyğəmbərlikdən əvvəl Hz. Məhəmməd onu əmisi Əbu Ləhəbin oğlu Utbəylə evləndirdi. Nəcm surəsi gələndən sonra Utbə Ruqiyəni boşadı. Onun əhvalatı Nəcm surəsinin təfsirində bəhs olunacaqdır. Ondan sonra Ruqiyəni Osman ibn Əffanla evləndirdi. O da peyğəmbər həyatda ikən vəfat etdi. 3-cü qızı Ümmü Külsümdür. Ruqiyə vəfat edəndən sonra onu da Osman ibn Əffanla evləndirdi və bu səbəbdən Osmana "zin-Nureyn" (iki nur sahibi) deyilir. O da peyğəmbərin sağlığında vəfat etdi. Peyğəmbər 4-cü qızı Fatimeyi-Zəhranı elm və kamilliyinə görə, qızlarının hamısından artıq istəyərdi. Onun özünü və anası Xədicəni digər qadınlardan üstün sayardı. Hədisdə buyurublar ki, dünya qadınları içində ən yaxşısı bu 4 qadındır 1) Asiyə Məzahim qızı fironun xanımı, hansı ki, Musaya (ə.s) iman gətirdi 2) Məryəm İmran qızı 3) Xədicə Xuveylid qızı 4) Fatimeyi-Zəhra Məhəmməd qızı) Peyğəmbərin digər qızlarından övladı olsa da, mübarək nəsli Fatimeyi-Zəhra ilə davam etmişdir).*

**53) (يَٓا اَيُّهَا الَّذ۪ينَ اٰمَنُوا لَا تَدْخُلُوا بُيُوتَ النَّبِيِّ) - Ey iman edənlər, peyğəmbərin evlərinə izinsiz daxil olub, əyləşib yeməyin gəlməsini gözləməyin ki, yeyəsiniz. (اِلَّٓا اَنْ يُؤْذَنَ لَكُمْ اِلٰى طَعَامٍ غَيْرَ نَاظِر۪ينَ اِنٰيهُ) - Heç vaxt izinsiz yeməkdən ötrü daxil olmayın, ancaq peyğəmbər özü sizi dəvət edib yeməyə izin verərsə, girin. (وَلٰكِنْ اِذَا دُع۪يتُمْ فَادْخُلُوا) - Lakin o zaman ki yeməyə dəvət olundunuz, daxil olun. (فَاِذَا طَعِمْتُمْ فَانْتَشِرُوا) - O zaman ki izindən sonra daxil olub yemək yediniz, durub gedin, (وَلَا مُسْتَأْنِس۪ينَ لِحَد۪يثٍ) - çox oturub bir-birinizlə ünsiyyət qurub söhbətlə məşğul olmayın. (اِنَّ ذٰلِكُمْ كَانَ يُؤْذِي النَّبِيَّ فَيَسْتَحْي۪ مِنْكُمْ) - Sizin bu əməliniz peyğəmbərə əziyyət verir, amma həya edib sizə deyə bilmir. Durub dağılın. (وَاللّٰهُ لَا يَسْتَحْي۪ مِنَ الْحَقِّ) - Amma Allah-Təala haqdan həya etməz, gərək Allah-Təala haqq sözü sizə yetirib sizə ədəb versin, habelə peyğəmbər də haqdan həya etməz, lakin bəzi caiz işlərdə insanlıq şərtlərinə görə, o cənab həya edib sözünü demirdi. Bu mübarək ayə bü-**

وَاِذَا سَاَلْتُمُوهُنَّ مَتَاعًا فَسْـَٔلُوهُنَّ مِنْ وَرَآءِ حِجَابٍۜ ذٰلِكُمْ اَطْهَرُ لِقُلُوبِكُمْ وَقُلُوبِهِنَّۜ وَمَا كَانَ لَكُمْ
اَنْ تُؤْذُوا رَسُولَ اللّٰهِ وَلَٓا اَنْ تَنْكِحُوٓا اَزْوَاجَهُ مِنْ بَعْدِه۪ٓ اَبَدًاۜ اِنَّ ذٰلِكُمْ كَانَ عِنْدَ اللّٰهِ عَظ۪يمًا ﴿٥٣﴾ اِنْ
تُبْدُوا شَيْـًٔا اَوْ تُخْفُوهُ فَاِنَّ اللّٰهَ كَانَ بِكُلِّ شَيْءٍ عَل۪يمًا﴿٥٤﴾

---

**tün islam ümmətindən ötrü ədəb verir. Gərək özgənin yeməyinə baxmayıb, öz qismətinlə kifayət edəsən. Bir şəxsin ki həmişə gözü özgə şəxslərin yeməyində ola, o şəxs insanlıq aləmindən çıxıb heyvanlığa düçar olar.** (Ömər ibn Xəttab çox çalışırdı ki, peyğəmbərin xanımları hicaba daxil olub onları görən olmasın. Çox vaxt bu mətləbdən bəhs edib peyğəmbərin xanımlarına deyərdi: "Əgər mənə bu mövzuda itaət olunsa, sizləri heç bir göz görə bilməz". Ondan sonra Allahın Rəsuluna xitab edib dedi: "Ey peyğəmbər, sənin hüzuruna yaxşı-yaman, mömin, fasiq (günahkar) gəlir, möminlərin analarına hicabı əmr etsən, yaxşıdır". Bir başqa vaxt Ömər məscidə gedib peyğəmbərin xanımlarını digər qadın və kişilərlə birlikdə görüb dedi: "Əgər siz örtünsəniz, digər qadınlardan fəzilətli olarsınız, necə ki ərinizin digər kişilərdən çox fəziləti var". Zeynəb dedi: "Vəhy bizim evimizdə gəlir, sən bizə paxıllıq edirsən". Bir gün peyğəmbər evdə yemək yeyirdi, o yeməkdə səhabədən bəziləri və Aişə də var idi. Yemək zamanı bir şəxsin əli Aişənin əlinə dəydi, Allahın Rəsulu bunu xoş görmədi və incidi. O zaman hicab ayəsi gəldi, bu mətləbdən Ömər ibn Xəttab son dərəcə şad oldu. Hicab ayəsi peyğəmbərin xanımlarına məxsusdur, amma digər müsəlman qadınlarının hicab hökmü haqqında Nur surəsində bəhs olunubdur). (وَاِذَا سَاَلْتُمُوهُنَّ مَتَاعًا فَسْـَٔلُوهُنَّ مِنْ وَرَآءِ حِجَابٍۜ) **- Ey möminlər, o zaman ki peyğəmbərin xanımlarından bir şey və ya ehtiyac üçün nə isə xahiş etsəniz, pərdə arxasından xahiş edib sual-cavab edin.** (ذٰلِكُمْ اَطْهَرُ لِقُلُوبِكُمْ وَقُلُوبِهِنَّ) **- Sizin pərdə arxasından sual-cavab etməyiniz həm sizi, həm peyğəmbər xanımlarını hər bir eyib və nöqsandan pak edər. Gərək, Allahın hökmünə tabe olub pak şeyləri əmələ gətirəsiniz.**

(وَمَا كَانَ لَكُمْ اَنْ تُؤْذُوا رَسُولَ اللّٰهِ وَلَٓا اَنْ تَنْكِحُوٓا اَزْوَاجَهُ مِنْ بَعْدِه۪ٓ اَبَدًاۜ) **- Siz möminlərdən ötrü caiz deyil ki, heç bir şeydən ötrü peyğəmbərə əziyyət edəsiniz və özü dünyadan köçəndən sonra sizdən ötrü onun xanımları ilə evlənmək əbədiyyən caiz deyildir, onlar sizə ana kimidirlər.** (اِنَّ ذٰلِكُمْ كَانَ عِنْدَ اللّٰهِ عَظ۪يمًا) **- Əgər peyğəmbərdən sonra belə bir əməl etsəniz, sizin bu əməliniz Allah-Təala yanında elə böyük günahdır ki, heç bir günah ona yetişməz.** (Allah-Təalanın peyğəmbərinə olan hörmətinə bu dəlil kifayət edər ki, onun xanımları ilə evlənməyi başqalarına haram etmişdir.

**54)** (اِنْ تُبْدُوا شَيْـًٔا اَوْ تُخْفُوهُ فَاِنَّ اللّٰهَ كَانَ بِكُلِّ شَيْءٍ عَل۪يمًا) **- Əgər siz peyğəmbərin xanımları ilə evlənməyi dilinizlə bildirsəniz, ya da ki qəlbinizdə gizlətsəniz, Allah-Təala gizlin və aşkar şeylərin hamısından agahdır, sizdən intiqam almağa qadirdir,** (elə ki Allah Rəsulunun xanımlarının haqqında hicab ayəsi

لَا جُنَاحَ عَلَيْهِنَّ فِيٓ اٰبَآئِهِنَّ وَلَآ اَبْنَآئِهِنَّ وَلَآ اِخْوَانِهِنَّ وَلَآ اَبْنَآءِ اِخْوَانِهِنَّ وَلَآ اَبْنَآءِ اَخَوَاتِهِنَّ وَلَا نِسَآئِهِنَّ وَلَا مَا مَلَكَتْ اَيْمَانُهُنَّۚ وَاتَّقِينَ اللّٰهَۜ اِنَّ اللّٰهَ كَانَ عَلٰى كُلِّ شَيْءٍ شَهِيدًا ﴿٥٥﴾ اِنَّ اللّٰهَ وَمَلٰٓئِكَتَهُ يُصَلُّونَ عَلَى النَّبِيِّۜ يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا صَلُّوا عَلَيْهِ وَسَلِّمُوا تَسْلِيمًا﴿٥٦﴾ اِنَّ الَّذِينَ يُؤْذُونَ اللّٰهَ وَرَسُولَهُ

---

gəldi, onların yanında hörməti olan şəxslər soruşdular: “Ey peyğəmbər, bəs biz də gərək onlarla hicab arxasından danışaq?” O vaxt bu mübarək ayə gəldi).

**55) (لَا جُنَاحَ عَلَيْهِنَّ فِيٓ اٰبَآئِهِنَّ) - Peyğəmbərin xanımlarına atalarıyla hicabsız danışmaqda heç bir günah yoxdur, (وَلَآ اَبْنَآئِهِنَّ) - nə də oğulları ilə** (Allah Rəsulunun bəzi xanımlarının əvvəlki ərlərindən oğulları var idi) **(وَلَآ اِخْوَانِهِنَّ) - nə qardaşları ilə, (وَلَآ اَبْنَآءِ اِخْوَانِهِنَّ) - nə qardaşlarının oğlanları ilə, (وَلَآ اَبْنَآءِ اَخَوَاتِهِنَّ) - nə bacılarının oğlanları ilə, (وَلَا نِسَآئِهِنَّ) - nə öz cinsləri olan qadınlarla, (وَلَا مَا مَلَكَتْ اَيْمَانُهُنَّ) - nə də malik olduqları qulamlarla - bu bəhs olunan şəxslərə qarşı hicabsız olmaqda peyğəmbərin xanımlarına heç bir günah yoxdur.* (وَاتَّقِينَ اللّٰهَ) - Ey peyğəmbər xanımları, Allahdan qorxub əmr olunan hicaba əməl edib caiz olmayan şəxslərlə hicabsız danışmayın. (اِنَّ اللّٰهَ كَانَ عَلٰى كُلِّ شَيْءٍ شَهِيدًا) - Həqiqətən, Allah-Təala hər bir şeyin zahirindən və batinindən agahdır, onun elmində gizlin və aşkarın fərqi yoxdur, ey peyğəmbər xanımları, Allah-Təaladan qorxub zahirdə hicaba əməl edib gizlində hicabı tərk etməyin.**

*(*__Qeyd:__ “Sual: “Nəyə görə Allah-Təala məhrəm şəxslərin arasında əmi və dayını qeyd etmədi, halbuki islam ümməti arasında onlar məhrəm, bəlkə də ən yaxın məhrəm hesab olunurlar”. Cavab: “Əmi və dayı adət-ənənədə valideyn kimi sayıldığına görə, onlardan bəhs edilmədi”).*

**56) (اِنَّ اللّٰهَ وَمَلٰٓئِكَتَهُ يُصَلُّونَ عَلَى النَّبِيِّ) - Ey möminlər, həqiqətən, Allah-Təala peyğəmbəri Məhəmmədə salavat və rəhmət göndərir, mələkləri də ondan ötrü rəhmət xahiş edirlər. (يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا صَلُّوا عَلَيْهِ وَسَلِّمُوا تَسْلِيمًا) - Ey iman edənlər, siz də peyğəmbərə salavat, salam göndərin.** (Soruşdular: “Ey peyğəmbər, sənə salam göndərməyi bilirik, amma salavat necə göndərək?”, buyurdu ki, belə deyin: (Allahümmə salli alə Muhəmmədin və alə ali Muhəmmədin kəma salleytə alə İbrahim və alə ali İbrahim innəkə həmidun məcid). (Müslüm, Salat 65; Buxari, Daavat 33) Sual: “Bəs peyğəmbərə salavat göndərmək vacibdir, yoxsa yox?” Cavab: “Hər vaxt mübarək adı (Məhəmməd s.a.v.) xatırlansa vacibdir. Digər vaxtlarda savabdır. Namazın “təşəhhüd”ündə (şəhadət miqdarı oturub ət-“təhiyyat”ı- salam duasını oxumaq) salavatın vacib olub-olmamasında islam alimləri ixtilaf ediblər. İmam Əbu Hənifə və onun davamçıları vacib saymayıblar, imam Şafii və İmamiyyə (şiə) alimləri vacib sayıblar”).

**57) (اِنَّ الَّذِينَ يُؤْذُونَ اللّٰهَ وَرَسُولَهُ) - Həqiqətən, o şəxslər ki Allah-Təalaya və**

لَعَنَهُمُ اللّٰهُ فِي الدُّنْيَا وَالْاٰخِرَةِ وَاَعَدَّ لَهُمْ عَذَابًا مُهِينًا ﴿٥٧﴾ وَالَّذٖينَ يُؤْذُونَ الْمُؤْمِنٖينَ وَالْمُؤْمِنَاتِ
بِغَيْرِ مَا اكْتَسَبُوا فَقَدِ احْتَمَلُوا بُهْتَانًا وَاِثْمًا مُبٖينًا ﴿٥٨﴾ يَٓا اَيُّهَا النَّبِيُّ قُلْ لِاَزْوَاجِكَ وَبَنَاتِكَ وَنِسَٓاءِ
الْمُؤْمِنٖينَ يُدْنٖينَ عَلَيْهِنَّ مِنْ جَلَابٖيبِهِنَّ ذٰلِكَ اَدْنٰٓى اَنْ يُعْرَفْنَ فَلَا يُؤْذَيْنَ وَكَانَ اللّٰهُ غَفُورًا رَحٖيمًا ﴿٥٩﴾
لَئِنْ لَمْ يَنْتَهِ الْمُنَافِقُونَ وَالَّذٖينَ فٖي قُلُوبِهِمْ مَرَضٌ وَالْمُرْجِفُونَ فِي الْمَدٖينَةِ

---

**onun peyğəmbəri Məhəmmədə əziyyət edib Allah-Təalaya şirk qoşub peyğəmbərinə itaət etməyələr, (لَعَنَهُمُ اللّٰهُ فِي الدُّنْيَا وَالْاٰخِرَةِ وَاَعَدَّ لَهُمْ عَذَابًا مُهِينًا) - Allah-Təala onlara dünya və axirətdə lənət edib öz rəhmətindən kənar salıb, xüsusən axirətdə onlardan ötrü zəlil və rəzil edən əzab hazırlayıbdır.**

**58) (وَالَّذٖينَ يُؤْذُونَ الْمُؤْمِنٖينَ وَالْمُؤْمِنَاتِ بِغَيْرِ مَا اكْتَسَبُوا) - O şəxslər ki mömin kişilərə və qadınlara əziyyətə səbəb olan əməlləri etmədikləri halda, nisbət edib səbəbsiz olaraq əziyyət edir, (فَقَدِ احْتَمَلُوا بُهْتَانًا وَاِثْمًا مُبٖينًا) - həqiqətən, o əziyyət edənlər o böhtanı və nisbət etdikləri günahı özlərinə yükləyiblər.** (Günahların ən böyüyü xalqa böhtan atıb onlarda olmayan yaman sifətləri və əməlləri dəqiq bilmədən, zənn və gümanla, onlara iftira ataraq isnad etməkdir, Allah-Təalanın məxluquna hüsni-rəğbət etmək lazımdır, nəinki bədgümanlıq edib çirkin əməlləri onlara nisbət vermək, şeytansifət, batinləri xəbis olan şəxslərdən belə əməllər meydana çıxar. (İslamın ilk dövrlərində azad qadınlar və kənizlər hamısı eyni cür libas geyinib başlarında balaca bir yaylıq, əyinlərində başdan-ayağa uzun bir paltarla dolanırdılar. Pis niyyətli şəxslər onlara sataşıb nalayiq sözlər deyirdilər. Allah-Təala növbəti ayədə azad qadınlara əmr edir ki, o balaca yaylıqdan başqa bir geniş çarşab (ərəbcə “cilbab”) geyinib, başlarına, boğazlarını sarıyıb, qalanını sinələrinə salsınlar ki, kənizlərdən fərqlənib, təmkinli və vüqarlı görünmələri səbəbinə pis niyyətli şəxslər onlardan kənar olsunlar. Ənəs ibn Malik deyir: “Ömər ibn Xəttab çarşab geyinmiş bir kənizlə qarşılaşdı”. Ömər əlindəki kiçik qamçını yuxarı qaldırıb kənizə dedi: “Sən özünü azad qadınlara oxşadırsan, çarşabı başından açmasını əmr etdi, bu ayədə bəhs olunur”).

**59) (يَٓا اَيُّهَا النَّبِيُّ قُلْ لِاَزْوَاجِكَ وَبَنَاتِكَ وَنِسَٓاءِ الْمُؤْمِنٖينَ يُدْنٖينَ عَلَيْهِنَّ مِنْ جَلَابٖيبِهِنَّ) - Ey peyğəmbər, xanımlarına, qızlarına və möminlərin xanımlarına de ki, çölə çıxanda çarşablarını geyinib başlarına salsınlar,** (islam alimlərinin əksəriyyəti bu ayəni hicaba dəlil sayıb çarşab başa salınanda hökmən gərək üzü də örtsünlər, deyiblər). **(ذٰلِكَ اَدْنٰٓى اَنْ يُعْرَفْنَ فَلَا يُؤْذَيْنَ) - qadınların çarşab geyməri pis niyyətli şəxslərin onları tanıyıb, əziyyət etməyib, onlara xəyanət gözü ilə baxmamasına səbəb olar. (وَكَانَ اللّٰهُ غَفُورًا رَحٖيمًا) - Allah-Təala bundan əvvəl onların çarşabsız gəzmələri səbəbi ilə onlara rəhm edib bağışlayandır.**

**60) (لَئِنْ لَمْ يَنْتَهِ الْمُنَافِقُونَ وَالَّذٖينَ فٖي قُلُوبِهِمْ مَرَضٌ وَالْمُرْجِفُونَ فِي الْمَدٖينَةِ) -** (Ey Məhəmməd), **əgər münafiqlər nifaqlarından və səninlə ədavət saxlamaq-**

لَنُغْرِيَنَّكَ بِهِمْ ثُمَّ لَا يُجَاوِرُونَكَ فِيهَآ اِلَّا قَلِيلًا ۚ ﴿٦٠﴾ مَلْعُونِينَ ۚ اَيْنَ مَا ثُقِفُوٓا اُخِذُوا وَقُتِّلُوا تَقْتِيلًا
﴿٦١﴾ سُنَّةَ اللهِ فِي الَّذِينَ خَلَوْا مِنْ قَبْلُ ۚ وَلَنْ تَجِدَ لِسُنَّةِ اللهِ تَبْدِيلًا ﴿٦٢﴾ يَسْـَٔلُكَ النَّاسُ عَنِ
السَّاعَةِ ۜ قُلْ اِنَّمَا عِلْمُهَا عِنْدَ اللهِ ۜ وَمَا يُدْرِيكَ لَعَلَّ السَّاعَةَ تَكُونُ قَرِيبًا ﴿٦٣﴾ اِنَّ اللهَ لَعَنَ الْكَافِرِينَ
وَاَعَدَّ لَهُمْ سَعِيرًاۙ ﴿٦٤﴾ خَالِدِينَ فِيهَآ اَبَدًاۚ لَا يَجِدُونَ وَلِيًّا وَلَا نَصِيرًاۚ ﴿٦٥﴾

---

**dan, qəlblərində pozğunluq olanlar fəsadlarından, cihada gedən müsəlmanların yalandan şikəst olması xəbərini möminlərə yetirib onların qəlblərini sındıranlar yalan söz gəzdirməkdən kənar olmayıb tövbə etməsələr, (لَنُغْرِيَنَّكَ بِهِمْ) -** (Ey Məhəmməd), **əlbəttə, o vaxt sənə əmr edərik ki, onları ələ keçirib zəlil və rəzil edəsən. (ثُمَّ لَا يُجَاوِرُونَكَ فِيهَآ اِلَّا قَلِيلًا) - Elə zəlil olsunlar ki, ondan sonra daha səninlə qonşu olub Mədinədə qala bilməsinlər, ancaq arvad-uşaqlarını yığıb qaçacaq qədər az bir zaman qala bilərlər.**

**61) (مَلْعُونِينَ) -** (Ey Məhəmməd), **onlar həmişə Allah-Təalanın rəhmətindən uzaqlaşdırılmış və kənar olarlar. (اَيْنَ مَا ثُقِفُوٓا اُخِذُوا وَقُتِّلُوا تَقْتِيلًا) - Onların barəsində hökm budur ki, harda tapılsalar, tutulub şiddətli şəkildə qətl edilsinlər.**

**62) (سُنَّةَ اللهِ فِي الَّذِينَ خَلَوْا مِنْ قَبْلُ) - Münafiqlərin barəsində bundan əvvəl yaşayan peyğəmbərlərin zamanında da Allah-Təalanın hökm və iradəsi belədir ki, bəhs olundu. (وَلَنْ تَجِدَ لِسُنَّةِ اللهِ تَبْدِيلًا) -** (Ey Məhəmməd), **Allah-Təalanın hökmü və iradəsi bütün zamanlarda eynidir. Allah-Təalanın iradəsində dəyişiklik tapa bilməzlər.**

**63) (يَسْـَٔلُكَ النَّاسُ عَنِ السَّاعَةِ) -** (Ey Məhəmməd), **xalq səndən qiyamət gününün vaqe olması haqqında soruşurlar ki, bəs nə vaxt vaqe olacaqdır? (قُلْ اِنَّمَا عِلْمُهَا عِنْدَ اللهِ ) -** (Ey Məhəmməd), **onlara de ki, qiyamətin elmi Allah-Təalanın yanındadır. Heç bir peyğəmbərini ondan agah etməyibdir. (وَمَا يُدْرِيكَ لَعَلَّ السَّاعَةَ تَكُونُ قَرِيبًا) -** (Ey Məhəmməd), **qiyamət işi və onun nə vaxt vaqe olması haqqında sənə heç nə bildirilməyibdir, bəlkə, qiyamətin vaqe olması yaxındır. Amma siz ondan agah deyilsiniz. Müşriklər istehza səbəbi ilə və yəhudilər imtahan etməkdən ötrü peyğəmbərdən qiyamət gününün vaxtını soruşurdular, sual verən müşriklər qiyaməti inkar etsələr də, yəhudilər buna etiqad edirdilər. Çünki onun məxfi olduğu Tövratda xəbər verilmişdi. Allah-Təala inkarçıları** (müşrikləri), **qorxudub, imtahan edənləri** (yəhudiləri) **sakitləşdirməkdən ötrü sıradakı ayəni bildirdi.**

**64) (اِنَّ اللهَ لَعَنَ الْكَافِرِينَ وَاَعَدَّ لَهُمْ سَعِيرًاۙ) - Həqiqətən, Allah-Təala qiyaməti inkar edən kafirlərə lənət edib onlardan ötrü axirətdə alov, od** (cəhənnəm odu) **hazır edibdir.**

**65) ( خَالِدِينَ فِيهَآ اَبَدًاۚ لَا يَجِدُونَ وَلِيًّا وَلَا نَصِيرًاۚ) - Cəhənnəm odunda həmişəlik qalıb, nə işlərini idarə edən, nə də onlara bir kömək edən tapa bilməzlər.**

يَوْمَ تُقَلَّبُ وُجُوهُهُمْ فِي النَّارِ يَقُولُونَ يَا لَيْتَنَآ اَطَعْنَا اللّٰهَ وَاَطَعْنَا الرَّسُولَا﴿٦٦﴾ وَقَالُوا رَبَّنَآ اِنَّآ اَطَعْنَا
سَادَتَنَا وَكُبَرَآءَنَا فَاَضَلُّونَا السَّبِيلَا﴿٦٧﴾ رَبَّنَآ اٰتِهِمْ ضِعْفَيْنِ مِنَ الْعَذَابِ وَالْعَنْهُمْ لَعْنًا كَبِيرًا ﴿٦٨﴾
يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا لَا تَكُونُوا كَالَّذِينَ اٰذَوْا مُوسٰى فَبَرَّاَهُ اللّٰهُ مِمَّا قَالُواۜ وَكَانَ عِنْدَ اللّٰهِ وَجِيهًا ﴿٦٩﴾
يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا اتَّقُوا اللّٰهَ وَقُولُوا قَوْلًا سَدِيدًاۙ ﴿٧٠﴾

---

66) (يَوْمَ تُقَلَّبُ وُجُوهُهُمْ فِي النَّارِ) - **O gün ki kafir və müşriklərin üzləri cəhənnəm odunda dövr edib dolanır,** (necə ki ət qazan içində qaynayan zaman dolanır), (يَقُولُونَ يَا لَيْتَنَآ اَطَعْنَا اللّٰهَ وَاَطَعْنَا الرَّسُولَا) **o vaxt deyərlər: "Kaş biz dünyada Allah-Təala və onun peyğəmbərinə itaət edib hər bir hökmlərinə əməl edəydik".**

67) (وَقَالُوا رَبَّنَآ اِنَّآ اَطَعْنَا سَادَتَنَا وَكُبَرَآءَنَا فَاَضَلُّونَا السَّبِيلَا) - **Cəhənnəmdə Allah-Təalaya dua, niyaz edib deyərlər: "Ey bizim rəbbimiz, həqiqətən, biz dünyada ağalarımıza və böyüklərimizə itaət etdik, onları özümüzə imam və rəhbər təyin etdik, onlar bizə halal, haram yolunu, din və məzhəb yolunu öz istədikləri kimi göstərib bizi zillətə salıb haqdan uzaqlaşdırdılar".**

68) (رَبَّنَآ اٰتِهِمْ ضِعْفَيْنِ مِنَ الْعَذَابِ وَالْعَنْهُمْ لَعْنًا كَبِيرًا) - **Ey bizim rəbbimiz, bizim rəislərimizə digər qəbirdəkilərə etdiyin əzabın iki qatı qədər əzab və davamlı lənət edib rəhmətindən onları uzaq et.**

69) (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا لَا تَكُونُوا كَالَّذِينَ اٰذَوْا مُوسٰى) - **Ey iman edənlər, o şəxslər ki, Musaya (ə.s) töhmət edib əziyyət etdilər, siz də onlar kimi Məhəmmədə (ə.s) töhmət edib əziyyət etməyin.** (Musanın düşməni olan Qarun bir əxlaqsız qadına bir miqdar pul verib dedi: "Musa camaat arasında durub onlara öyüd-nəsihət edəndə sən camaat arasında durub de: "Ey Musa, sən xalqa nəsihət edirsən, amma sən özün filan vaxt məni pis bir işə dəvət etdin. "O əxlaqsız qadın o zaman Allah-Təalanın lütf və mərhəmətilə tövbəkar olub ayağa durub dedi: "Ey Musa, Qarun mənə bir miqdar pul verib ki, sənə töhmət edib, nalayiq əməli sənə isnad verim. Allah-Təalanın bu ayədə bildirdiyi kimi Musanın əziyyəti bundan ibarətdir). (فَبَرَّاَهُ اللّٰهُ مِمَّا قَالُواۜ وَكَانَ عِنْدَ اللّٰهِ وَجِيهًا) - **Allah-Təala cənab Musanı onlar deyən işdən uzaq edib nicat verdi, Musa Allah-Təala yanında hörmət sahibi olan bir şəxs idi. Siz möminlər də Allahın Rəsulu olan Məhəmməd (s.a.v.) haqqında nalayiq sözlər deməyin. Allah-Təala onu təmiz edib günahın ağırlığı sizə qalar).**

70) (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا اتَّقُوا اللّٰهَ وَقُولُوا قَوْلًا سَدِيدًاۙ) - **Ey iman gətirən şəxslər, Allah-Təaladan qorxub, pis sözləri tərk edib, haqq və ədalət üzrə danışmağa niyyət edib, ədalətdən kənar olmayın.**

يُصْلِحْ لَكُمْ اَعْمَالَكُمْ وَيَغْفِرْ لَكُمْ ذُنُوبَكُمْ ۗ وَمَنْ يُطِعِ اللهَ وَرَسُولَهُ فَقَدْ فَازَ فَوْزًا عَظِيمًا ﴿٧١﴾ اِنَّا
عَرَضْنَا الْاَمَانَةَ عَلَى السَّمٰوَاتِ وَالْاَرْضِ وَالْجِبَالِ فَاَبَيْنَ اَنْ يَحْمِلْنَهَا وَاَشْفَقْنَ مِنْهَا وَحَمَلَهَا الْاِنْسَانُ
ۜ اِنَّهُ كَانَ ظَلُومًا جَهُولًاۙ ﴿٧٢﴾ لِيُعَذِّبَ اللهُ الْمُنَافِقِينَ وَالْمُنَافِقَاتِ وَالْمُشْرِكِينَ وَالْمُشْرِكَاتِ وَيَتُوبَ
اللهُ عَلَى الْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ وَكَانَ اللهُ غَفُورًا رَحِيمًا﴿٧٣﴾

---

**71) (يُصْلِحْ لَكُمْ اَعْمَالَكُمْ وَيَغْفِرْ لَكُمْ ذُنُوبَكُمْ) - Əgər siz haqq və ədalət üzrə danışsanız, Allah-Təala sizin xeyir əməllərinizi qüsursuz edib, eyib və nöqsanınızı islah edib günahlarınızı bağışlayar. (وَمَنْ يُطِعِ اللهَ وَرَسُولَهُ فَقَدْ فَازَ فَوْزًا عَظِيمًا) - Kim, Allah-Təala və onun peyğəmbərinə itaəət edib şirk və fəsaddan kənar olsa, həqiqətən, o şəxs böyük xeyirə vasil olubdur.**

**72) (اِنَّا عَرَضْنَا الْاَمَانَةَ عَلَى السَّمٰوَاتِ وَالْاَرْضِ وَالْجِبَالِ)** - (Ey Məhəmməd), **həqiqətən, insan nəslinə verdiyimiz əmanətimizi** (ağıl gücünü) **əvvəlcə nəhəng ulduzlara, göylərə, yerə və bir də dağlara təklif etdik. Bəs sizdə o qabiliyyət varmı ki, bu əmanəti yüklənib onun haqqını yerinə yetirəsiniz? (فَاَبَيْنَ اَنْ يَحْمِلْنَهَا وَاَشْفَقْنَ مِنْهَا) - O əmanətin haqqını yerinə yetirməkdən qorxub, onu daşımanın məsuliyyətindən çəkinib qəbul etmədilər. (وَحَمَلَهَا الْاِنْسَانُ ۜ اِنَّهُ كَانَ ظَلُومًا جَهُولًاۙ) - Lakin insan o əmanətə məsul olub qəbul etdi. Həqiqətən, insan o əmanətin haqqını düşünməyib, cəhalət səbəbinə o əmanətin haqqını verməyib zalım oldu. İnsan nəsli elmin mənşəyinə** (ağıl gücünə) **sahib olub, zamanın gərdişi ilə əcaib və qəribə elmlər ondan meydana gəldiyinə görə, Allah-Təala bu mübarək ayədə insanın digər məxluqata nisbətən olan ucalığını və fəzilətini bildirməkdən ötrü göyləri və yeri ağıl sahibi kimi fərz edir, amma təklifi qəbul etməmələrini onların əsl fitrət və ünsürlərinin əmanətə layiq olmaması səbəbi ilə (فَاَبَيْنَ اَنْ يَحْمِلْنَهَا وَاَشْفَقْنَ مِنْه) - ifadəsi ilə göstərir, lakin insanın əsl fitrət və təbiətinin əmanəti qəbul etməyə uyğun olduğunu (وَحَمَلَهَا الْاِنْسَانُ ۜ) - şəklində ifadə edib insanın digər məxluqata olan üstünlüyünü bəyan buyurur. Amma insanların əksəriyyətinin ağıla tabe olmayıb axmaqlığı ağıla, cəhaləti elmə üstün sayıb seçdikləri** (İnnəhu kanə zələmu cəhulən) ibarəsilə göstərilir)**.**

**73) (لِيُعَذِّبَ اللهُ الْمُنَافِقِينَ وَالْمُنَافِقَاتِ وَالْمُشْرِكِينَ وَالْمُشْرِكَاتِ) - İnsan əmanəti yükləndi belə ki, öz ixtiyarları ilə əmanəti zay edən münafiq və müşrik kişilərə və qadınlara Allah-Təala əzab etsin. (وَيَتُوبَ اللهُ عَلَى الْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ) - Və əmanətin haqqını verərək Allah-Təala tərəfinə dönüb, tövbə edən mömin kişilərin və qadınların tövbələrini qəbul edib onlara bol savab versin. (وَكَانَ اللهُ غَفُورًا رَحِيمًا) - Allah-Təala tövbə edən şəxslərə rəhm edib bağışlayandır. Allaha həmd olsun. Əhzab surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: "Kim, Əhzab surəsini oxuyub ailəsinə və xidmətçilərinə**

**təlim etsə, Allah-Təala ona qəbir əzabından aman verər". Nə gözəl surədir, nə çox uca ehkamı ehtiva edir. Xüsusən, qadınların haqqında islam ümməti üçün vacibdir. Bu mübarək surənin ehkamını necə ki uca peyğəmbər buyurub, özləri öyrənib, ailə və dostlarına da öyrətsinlər. Allah Müvəffəq etsin.**

## SƏBA SURƏSİ

34-cü surədir. Məkkədə nazil olub, 54 ayə, 833 kəlmə və 1512 hərfdir.

اَلْحَمْدُ لِلّٰهِ الَّذٖي لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ وَلَهُ الْحَمْدُ فِي الْاٰخِرَةِ وَهُوَ الْحَكٖيمُ الْخَبٖيرُ ﴿١﴾ يَعْلَمُ مَا يَلِجُ فِي الْاَرْضِ وَمَا يَخْرُجُ مِنْهَا وَمَا يَنْزِلُ مِنَ السَّمَآءِ وَمَا يَعْرُجُ فٖيهَا

---

### Bismillahir-Rəhmanir-Rəhim

**1) (اَلْحَمْدُ لِلّٰهِ الَّذٖي لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ) - Həmd-səna yeganə məbud olan Allah-Təalaya layiqdir ki, bütün göylərdə və yerdə olan şeylər hamısı ona məxsus və ondan meydana gələn nemətdir. Gərək, bütün dünya nemətlərindən ötrü Allah-Təalaya həmd edilsin. (وَلَهُ الْحَمْدُ فِي الْاٰخِرَةِ) - Necə ki dünya nemətlərindən ötrü gərək dünyada Allah-Təalaya həmd olunsun, habelə axirət nemətlərindən ötrü də gərək axirətdə Allah-Təalaya həmd olunsun.** (Lakin fərqi budur ki, dünyada nemətlərin müqabilində həmd etmək vacibdir. Amma axirətdə neməti haqqı olana vermək vacib olduğuna görə həmd etmək vacib deyildir. Bəlkə, möminlər fərəh və sevinclərindən, nemətlərdən ləzzət aldıqlarına görə, həmd-səna edib bundan ləzzət alarlar. Necə ki susuz şəxs şirin, soyuq sudan ləzzət alar). **(وَهُوَ الْحَكٖيمُ الْخَبٖيرُ) Allah-Təala hikmət sahibidir, dünya və axirətin işlərini hikmət üzrə tədbir edib xalqın bütün əməllərindən agah və xəbərdardır.**

**2) (يَعْلَمُ مَا يَلِجُ فِي الْاَرْضِ وَمَا يَخْرُجُ مِنْهَا) - Hər bir şey ki yerin təkinə daxil olub və yerdən çıxır, Allah-Təala onlardan agahdır, (dünyada bütün varlıqlar və müxtəlif növ nemətlər yerdən çıxıb axırda yenə yerə qayıdıb, qaranlıq torpağa çevriləcəkdir. (وَمَا يَنْزِلُ مِنَ السَّمَآءِ وَمَا يَعْرُجُ فٖيهَا) - Göylərdən enib göyə qalxan şeylərdən də Allah-Təala agahdır. Yağış və qar göydən enib, yer üzünü sulayıb, yer zümrüd rəngini alandan sonra sular buxar surətinə daxil olub, sonsuz fəzaya qalxacaqdır, ayə işarə edir ki, rütubət və hərarət havadan yer kürəsinə nüfuz edib, ondan yaranan maddələrə, və ona məxsus elmlə onların yerdən çıxmağına və yer ünsürlərinin bir-birinə müvafiq, ya da müxalif olmasından meydana gələn maddələrə, və onların xüsusiyyətlərinə Allah-Təala agahdır.**

**O elmlərdən zəmanənin tələbinə görə, lazım olan qədər hər bir dövrdə insanlığın şüuruna əmanət edib meydana gətirir, ki, insan Allah-Təalanın kamil qüdrətinə və elminin sonsuzluğuna agah olub, tövhid aləminə daxil olub doğru insan olsunlar, mübarək ayələrin mənasında buna xeyli belə işarə var.**

وَهُوَ الرَّحِيمُ الْغَفُورُ ﴿٢﴾ وَقَالَ الَّذِينَ كَفَرُوا لَا تَأْتِينَا السَّاعَةُ قُلْ بَلٰى وَرَبِّي لَتَأْتِيَنَّكُمْ عَالِمِ الْغَيْبِ لَا يَعْزُبُ عَنْهُ مِثْقَالُ ذَرَّةٍ فِي السَّمٰوَاتِ وَلَا فِي الْاَرْضِ وَلَٓا اَصْغَرُ مِنْ ذٰلِكَ وَلَٓا اَكْبَرُ اِلَّا فِي كِتَابٍ مُبِينٍ ﴿٣﴾ لِيَجْزِيَ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ اُولٰٓئِكَ لَهُمْ مَغْفِرَةٌ وَرِزْقٌ كَرِيمٌ ﴿٤﴾ وَالَّذِينَ سَعَوْ فِيٓ اٰيَاتِنَا مُعَاجِزِينَ اُولٰٓئِكَ لَهُمْ عَذَابٌ مِنْ رِجْزٍ اَلِيمٌ ﴿٥﴾ وَيَرَى الَّذِينَ اُوتُوا الْعِلْمَ الَّذِيٓ اُنْزِلَ اِلَيْكَ مِنْ رَبِّكَ هُوَ الْحَقَّ وَيَهْدِيٓ اِلٰى صِرَاطِ الْعَزِيزِ الْحَمِيدِ ﴿٦﴾ وَقَالَ الَّذِينَ كَفَرُوا هَلْ نَدُلُّكُمْ عَلٰى رَجُلٍ يُنَبِّئُكُمْ اِذَا مُزِّقْتُمْ كُلَّ مُمَزَّقٍ اِنَّكُمْ لَفِي خَلْقٍ جَدِيدٍ ﴿٧﴾

---

**Lakin bizim həqiqətə baxan gözlərimiz cəhalət pərdəsi ilə tutulub, onları dərk etməkdən aciz qalmışıq. (وَهُوَ الرَّحِيمُ الْغَفُورُ) - Allah-Təala həmd-səna edənləri və nemətlərinin müqabilində şükür edib günahının bağışlanmasını istəyənləri rəhm edib bağışlayandır.**

**3) (وَقَالَ الَّذِينَ كَفَرُوا لَا تَأْتِينَا السَّاعَةُ) -** (Ey Məhəmməd), **kafir və müşriklər dedilər: “O qiyaməti ki Allah-Təala vəd edir, o bizə gəlməyib və vaqe olmayacaqdır”. (قُلْ بَلٰى وَرَبِّي لَتَأْتِيَنَّكُمْ عَالِمِ الْغَيْبِ) -** (Ey Məhəmməd), **onlara de ki, bəli, and olsun qeybə agah olan mənim rəbbimə, əlbəttə, qiyamət günü sizə gələcəkdir. (لَا يَعْزُبُ عَنْهُ مِثْقَالُ ذَرَّةٍ فِي السَّمٰوَاتِ وَلَا فِي الْاَرْضِ)- Allah-Təala elə alimdir ki, zərrə ağırlığında bir şey nə göylərdə, nə də yerdə onun elmindən gizli olmaz. (وَلَٓا اَصْغَرُ مِنْ ذٰلِكَ وَلَٓا اَكْبَرُ اِلَّا فِي كِتَابٍ مُبِينٍ) - Zərrədən nə kiçik, nə də böyük heç bir şey yoxdur, hamısı Allahın elmində qeyd olunubdur.**

**4) (لِيَجْزِيَ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ) - Allah-Təalanın elmi hər bir şeyi əhatə edib qiyamət günü sizə gələcəkdir ki, Allah-Təalaya iman edib, xeyir əməl edən şəxslərə xeyirli mükafat versin. (اُولٰٓئِكَ لَهُمْ مَغْفِرَةٌ وَرِزْقٌ كَرِيمٌ) Bəhs olunan möminlərin mükafatı budur ki, onlardan ötrü Allah-Təala yanında bağışlanmaq və gözəl ruzi vardır.**

**5) (وَالَّذِينَ سَعَوْ فِيٓ اٰيَاتِنَا مُعَاجِزِينَ ) - Qiyamət günü sizə gələcəkdir ki, Allah-Təala cəza versin o şəxslərə ki, bizim ayələrimizi batil etməyə səy edib güman edirlər ki, bizi aciz edib, özləri əzabımızdan əvvəl ölüb, xilas olacaqlar. (اُولٰٓئِكَ لَهُمْ عَذَابٌ مِنْ رِجْزٍ اَلِيمٌ) Onlardan ötrü qiyamət günündə əziyyət verən şiddətli, yaman əzab vardır.**

**6) (وَيَرَى الَّذِينَ اُوتُوا الْعِلْمَ الَّذِيٓ اُنْزِلَ اِلَيْكَ مِنْ رَبِّكَ هُوَ الْحَقَّ) -** (Ey Məhəmməd), **sənə tabe olan elm sahibləri möminlər agah olub, iman edirlər ki, sənin rəbbin Allah-Təaladan sənə gələn kitab haqq və Allah-Təala tərəfindəndir. (وَيَهْدِيٓ اِلٰى صِرَاطِ الْعَزِيزِ الْحَمِيدِ) o kitab** (Quran) **bütün məxluqata qalib gəlib, həmd-sənaya layiq olan Allah-Təalanın yoluna, dininə hidayət edir.**

**7) (وَقَالَ الَّذِينَ كَفَرُوا) - Qüreyş camaatından olan Məkkə əhlindən bəziləri digərlərinə dedilər: (هَلْ نَدُلُّكُمْ عَلٰى رَجُلٍ يُنَبِّئُكُمْ اِذَا مُزِّقْتُمْ كُلَّ مُمَزَّقٍ اِنَّكُمْ لَفِي خَلْقٍ جَدِيدٍ)**

اَفْتَرٰى عَلَى اللّٰهِ كَذِبًا اَمْ بِه۪ جِنَّةٌ ۜ بَلِ الَّذ۪ينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِ فِي الْعَذَابِ وَالضَّلَالِ الْبَع۪يدِ ﴿٨﴾
اَفَلَمْ يَرَوْا اِلٰى مَا بَيْنَ اَيْد۪يهِمْ وَمَا خَلْفَهُمْ مِنَ السَّمَٓاءِ وَالْاَرْضِۜ اِنْ نَشَاْ نَخْسِفْ بِهِمُ الْاَرْضَ اَوْ
نُسْقِطْ عَلَيْهِمْ كِسَفًا مِنَ السَّمَٓاءِۜ اِنَّ ف۪ي ذٰلِكَ لَاٰيَةً لِكُلِّ عَبْدٍ مُن۪يبٍ ﴿٩﴾

---

**- İstəyirsinizsə, sizə göstərək o kişini ki** (Məhəmmədə) **sizə təəccüblü bir xəbər verir.** (Bu kəlamı məsxərə və istehza etmək üçün dedilər, çünki peyğəmbərin əmri və qadağaları heç kimə gizli deyildi). **O söz budur ki, sizə deyir: “O zaman ki sizin bədəniniz dağılıb, hissələri bir-birindən aralanıb, birdəfəlik parçalanıb, torpaq oldu, ondan sonra təzədən yaranıb diriləcəksiniz. Bədən dağılıb torpaq olandan sonra yenidən dirilmək çox təəccüblü işdir.**

**8)** (اَفْتَرٰى عَلَى اللّٰهِ كَذِبًا اَمْ بِه۪ جِنَّةٌ) **- Bu ki, deyir: “Allah-Təala sizə yenidən həyat verəcək”, bu sözü yalandan deyib, Allah-Təalaya iftira edir. Ya da ki onda dəlilik vardır. Dəli olduğu üçün bu sözlər ondan meydana çıxır.** (Allah-Təala sıradakı ayədə müşriklərin bu sözünü də buyurur).

(بَلِ الَّذ۪ينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِ فِي الْعَذَابِ وَالضَّلَالِ الْبَع۪يدِ) - (Məhəmməd) **bu sözləri ilə nə Allah-Təalaya iftira edir, nə də onda dəlilik vardır, hər ikisindən də uzaqdır. Bəlkə, axirətə iman etməyən inkarçı şəxslər dünyada haqdan uzaq olub, zillətə düşdüklərinə görə, yenidən dirilməyi inkar edirlər. Dəlilik və axmaqlıq budur, Məhəmmədin sözləri deyil.**

**9)** (اَفَلَمْ يَرَوْا اِلٰى مَا بَيْنَ اَيْد۪يهِمْ وَمَا خَلْفَهُمْ مِنَ السَّمَٓاءِ وَالْاَرْضِۜ) **- Bəs müşriklərin gözləri kor olub, bir qabaqlarına və arxalarına baxmırlar ki, harda olsalar, hara getsələr, göylər və yer onları əhatə edib onların əhatəsindən çıxmağa qüdrətləri yoxdur. Bundan ibrət götürüb bizim tövhid və qüdrətimizə agah olsunlar.** (اِنْ نَشَاْ نَخْسِفْ بِهِمُ الْاَرْضَ) **- Bizim qüdrətimiz elə bir dərəcədədir ki, əgər istəsək, onları** (Qarun kimi) **məcburən və zorla yerin altına batırıb qərq edərik,** (اَوْ نُسْقِطْ عَلَيْهِمْ كِسَفًا مِنَ السَّمَٓاءِ) **- ya da ki göy tərəfindən bir parça od göndərib onları yandırıb həlak edərik. Heç bir halda bizim qüdrətimizə tabe olmaqdan xaric ola bilməzlər.**

(اِنَّ ف۪ي ذٰلِكَ لَاٰيَةً لِكُلِّ عَبْدٍ مُن۪يبٍ) **- Həqiqətən, göylərə və yerə təfəkkür ilə nəzər etməkdə Allah-Təala tərəfinə dönüb itaət edən bəndələrdən ötrü Allah-Təalanın tövhid və qüdrətinə dəlil, sübut vardır.** (Allah-Təala Davuda (ə.s) kitab (“Zəbur”) verib gözəl səs bəxş etmişdi. Səltənət qərargahından çıxıb səhrada dağların zirvəsində “Zəbur” oxuyanda dağlar onun səsinə əks-səda verib, (necə ki dağların səsə əks-səda verməsi məlumdur) gözəl səsini daha da artırıb onun nəğməsinə quşlar cəm olardılar. Habelə dəmirdən zireh toxumağı Allah-Təala ona ağlı vasitəsi ilə öyrətdi. Dəmirdən zireh düzəldən

وَلَقَدْ اٰتَيْنَا دَاوُدَ مِنَّا فَضْلًاؕ يَا جِبَالُ اَوِّبِي مَعَهُ وَالطَّيْرَۚ وَاَلَنَّا لَهُ الْحَدِيدَۙ ﴿١٠﴾ اَنِ اعْمَلْ سَابِغَاتٍ وَقَدِّرْ فِي السَّرْدِ وَاعْمَلُوا صَالِحًاؕ اِنِّي بِمَا تَعْمَلُونَ بَصِيرٌ ﴿١١﴾ وَلِسُلَيْمٰنَ الرِّيحَ غُدُوُّهَا شَهْرٌ وَرَوَاحُهَا شَهْرٌۚ

---

ilk şəxs cənab Davuddur (ə.s). Allah-Təala Davuda bəxş etdiyi fəzilətləri sıradakı mübarək ayədə xəbər verir).

**10) (وَلَقَدْ اٰتَيْنَا دَاوُدَ مِنَّا فَضْلًاؕ) - (Ey Məhəmməd), həqiqətən, biz öz tərəfimizdən Davuda lütf edib peyğəmbərlik və kitab** (“Zəbur”) **bəxş etdik. (يَا جِبَالُ اَوِّبِي مَعَهُ وَالطَّيْرَ) - Dağlara və quşlara xitab edib dedik: “Siz də Davudla birlikdə oxuyub, onun səsinə əks-səda verin”. Heyvanat və maddələr Allah-Təalanın qüdrətinə tabe olduğu üçün dağlar və quşlar ağıl sahibi kimi fərz edilib onlara xitab olunur. (وَاَلَنَّا لَهُ الْحَدِيدَ) - Zireh toxumağı Davuda təlim edib ondan ötrü dəmiri xəmir və ya mum kimi yumşaq etdik, ondan həlqələr tərtib edib zireh toxuyurdu. Təfsir alimləri deyiblər: “Dəmirin yumşaq olmağını Allah-Təala Davud peyğəmbərdən ötrü möcüzə etmişdi. Soyuq dəmir onun əlində mum kimi yumşaq olurdu”. Lakin ayədə dəmirin möcüzə olması haqqında bir dəlil yoxdur. Möcüzə xalqı dəvət etmək üçün olar, Allah-Təala dəmirin yumşaq olmağını xalqın dəvəti mövzusunda ifadə etməyibdir ki, möcüzə sayılsın. Bir də möcüzə bir dəfə, ya da iki dəfə olar. Cənab Davud ömrünü zireh toxumağa sərf edib, onu özünə sənət seçmişdi və həyatını, məişətini onunla sürdürürdü. Xalq arasında, ya da öz evində sənətlə məşğul olub, ondan sonra onu satıb, özünə və ailəsinə sərf edib, bir qədər də yoxsullara xərcləyirdi. Belə bir şeyə möcüzə demək ağılsızlıqdır. Bəlkə, dəmiri əridib, düzəldib zireh hazırlamaq elmini Allah-Təala o cənaba təlim etmişdi. Ondan əvvəl dəmiri əridib düzəltmək elmi insan nəsli arasında meydana gəlməmişdi. Allah-Təala Davudun (ə.s) ağlına əmanət qoyulan dəmir elmini zühur etdirib, bu elm o cənabdan yer kürəsinə yadigar qaldı. Belə bir elmi möcüzə saymaqda məqsəd nədir? Elmin şərəfini və alilik dərəcəsini Allah-Təalanın Qurani-Şərifdə uca peyğəmbərimizə əmr etdiyi (وَقُلْ رَبِّ زِدْنِي عِلْمًا) “Ey Rəbbim! Mənim elmimi artır!” – de.** (Taha 20/114) **ayəsindən, gərək, anlayaq.**

**11) (اَنِ اعْمَلْ سَابِغَاتٍ) - Davuda əmr edib dedik, dəmirdən bol, mükəmməl zirehlər tərtib et. (وَقَدِّرْ فِي السَّرْدِ) - Zirehi toxuyub onun həlqələrini dar elə. Belə ki, hərb aləti ondan keçib bədənə təsir etməsin. (وَاعْمَلُوا صَالِحًاؕ) - Ey Davudun ailəsi, xeyir əməllər edib Allah-Təalaya itaət edin. (اِنِّي بِمَا تَعْمَلُونَ بَصِيرٌ) - Həqiqətən, mən sizin əməllərinizi görüb agah oluram.**

**12) (وَلِسُلَيْمٰنَ الرِّيحَ) - Və Süleymana küləyi tabe etdik, onun istəyinə müvafiq hərəkət edib hər bir tərəfə istəsəydi, onun xalısını aparardı. (غُدُوُّهَا شَهْرٌ وَرَوَاحُهَا شَهْرٌ) - Külək Süleymanın xalısını səhərlər bir aylıq**

وَاَسَلْنَا لَهُ عَيْنَ الْقِطْرِط وَمِنَ الْجِنِّ مَنْ يَعْمَلُ بَيْنَ يَدَيْهِ بِاِذْنِ رَبِّهٖ وَمَنْ يَزِغْ مِنْهُمْ عَنْ اَمْرِنَا نُذِقْهُ مِنْ
عَذَابِ السَّعِيرِ ﴿١٢﴾ يَعْمَلُونَ لَهُ مَا يَشَاۤءُ مِنْ مَحَارِيبَ وَتَمَاثِيلَ وَجِفَانٍ كَالْجَوَابِ وَقُدُورٍ رَاسِيَاتٍ
اِعْمَلُوۤا اٰلَ دَاوُدَ شُكْرًاط وَقَلِيلٌ مِنْ عِبَادِيَ الشَّكُورُ ﴿١٣﴾ فَلَمَّا قَضَيْنَا عَلَيْهِ الْمَوْتَ مَا دَلَّهُمْ عَلٰى
مَوْتِهٖۤ اِلَّا دَاۤبَّةُ الْاَرْضِ تَاْكُلُ مِنْسَاَتَهُ

---

**yol, axşamlar da bir aylıq yol qədər aparıb gətirirdi. Təfsirçilər ayənin mənasını belə izah ediblər. Amma ola bilər ki, cənab Süleyman elm qüvvəsilə bu zamanda tərtib edilən hava aləti kimi bir şey düzəltmişdi ki, o şey küləyin hərəkəti ilə hərəkət edib havada dolanırdı. Hədislərdə bəhs edilən Süleymanın xalısı bu fikri qüvvətləndirir. Doğrusunu Allah bilir. (وَاَسَلْنَا لَهُ عَيْنَ الْقِطْرِط) - Süleymandan ötrü mis mədənini su kimi əridib hər bir şeyə qabil təyin etdik. Necə ki Allah-Təala dəmiri əridib islah etmək elmini Davuda bəxş etdi, habelə misi əridib ondan nəsə düzəltməyi də Süleymana bəxş etdi. (وَمِنَ الْجِنِّ مَنْ يَعْمَلُ بَيْنَ يَدَيْهِ بِاِذْنِ رَبِّهٖ) - Cin tayfasından bəzi kamil ustalar var idi ki, Süleymanın hüzurunda rəbbi Allah-Təalanın izin və əmri ilə ondan ötrü gözəl sənət əsərləri tərtib edirdilər. (وَمَنْ يَزِغْ مِنْهُمْ عَنْ اَمْرِنَا نُذِقْهُ مِنْ عَذَابِ السَّعِيرِ) - Cinlərdən kim, bizim əmrimizdən kənara çıxıb, Süleymana itaət etməsəydi, ona axirətdə od əzabını daddıracağımızı bildirmişdik.**

**13) (يَعْمَلُونَ لَهُ مَا يَشَاۤءُ مِنْ مَحَارِيبَ) - Süleymandan ötrü istədiyi uca və ali qəsrlərdən və imarətləri təmir edirdilər. (وَتَمَاثِيلَ) - Misdən, daşdan və digər şeylərdən ondan ötrü peyğəmbər, mələk və s. surətlərdə uca, son dərəcə hündür heykəllər tərtib edirdilər. Süleyman bu heykəlləri tərtib edib Beytül-müqəddəsin** (Qüdsdəki əl-Əqsa məscidi) **daxilində və xaricində dikməyi əmr etdi. Amma hər hansı bir şəkildə surət, heykəl tərtib edib, saxlamaq islam şəriətində Allahın Rəsulu tərəfindən qadağan və haram elan olundu. İslam ümmətinin bununla iftixar etməsi layiq və münasibdir. (وَجِفَانٍ كَالْجَوَابِ) - Süleymandan ötrü böyük hovuz kimi çanaqlar tərtib etdilər. (وَقُدُورٍ رَاسِيَاتٍ) - Gələn qonaqlar və yoxsullardan ötrü yemək hazırlamaq üçün ocaqların üstündə möhkəm duran qazanlar düzəltdilər. Onların böyüklüyündən onları götürüb, qaldırmaq mümkün deyildi.** (Cənab Süleyman Beytül-müqəddəsin binasını tikib, bəhs olunan əşyanı Beytül-müqəddəsdən ötrü tərtib etmişdi). **(اِعْمَلُوۤا اٰلَ دَاوُدَ شُكْرًا) - Davudun ailəsinə və övladına dedik: "Ey Davudun ailəsi, Allah-Təalanın nemətlərinə şükür edərək, Allah-Təalaya itaət və ibadət edin". (وَقَلِيلٌ مِنْ عِبَادِيَ الشَّكُورُ ) - Lakin** (ey Məhəmməd), **gücü çatdığı qədər mənə şükür edən bəndələrim azdır.**

**14) (فَلَمَّا قَضَيْنَا عَلَيْهِ الْمَوْتَ مَا دَلَّهُمْ عَلٰى مَوْتِهٖۤ اِلَّا دَاۤبَّةُ الْاَرْضِ تَاْكُلُ مِنْسَاَتَهُ) -** (Ey Məhəmməd), **o zaman ki, Süleymanın ömrü tamamlanıb, onun ruhunun alınmasını hökm etdik, ölüm ona gəlib, ruhu alındı. Heç bir şey onun ölü-**

**münü xalqa bildirmədi. Ancaq yerdə hərəkət edən bir zəif heyvan** (ağac qurdu) **ki, onun əsasını içəridən yeyirdi. Elə ki o heyvanın yeməsindən əsa sınıb Süleyman yıxıldı. O vaxt xalqa onun öldüyü məlum oldu.** (فَلَمَّا خَرَّ تَبَيَّنَتِ الْجِنُّ اَنْ لَوْ كَانُوا يَعْلَمُونَ الْغَيْبَ مَا لَبِثُوا فِي الْعَذَابِ الْمُهِينِ) **- O zaman ki əsa sınıb, Süleyman yıxılıb, onun ölməyi məlum oldu, onun xidmətində olan cinlərə məlum oldu ki, qeyb elmi ancaq Allah-Təalaya məxsusdur, əgər qeybdən agah olsaydılar, Süleymanın ölməyindən xəbərdar olub, ondan ötrü işləmək əzabına, məşəqqətinə qatlanmayıb xilas olardılar. Süleyman 53 il dünyada ömür sürüb, 13 yaşında sultan olub, hakimiyyətinin 4-cü ilində Beytül-müqəddəsin binasını tikməyə başladı. Cinlər və şeytanlar Beytül-müqəddəsdə işləməklə məşğul idilər. Beytül-müqəddəsin tikintisi tamamlanmamış, Süleymanın əcəli gəldi. Ondan ötrü şüşədən bir ev hazırlamışdılar. Süleyman oradan cinlərə, şeytanlara baxıb, onlar da işlə məşğul olurdular. Allah-Təala Süleymanın ruhunu həmin şüşə evin içində əsaya söykənmiş halda aldı. Lakin Beytül-müqəddəsin tikintisi tamam olandan sonra ağac qurdu** (qarışqa) **əsanı yeməyə başladı. Ta o vaxta kimi ki, əsa sındı, Süleyman yıxıldı, onun ölməyi cinlərə və şeytanlara məlum olub dağıldılar. O vaxt artıq Beytül-müqəddəsin binasının tikintisi tamamlanmışdı. Ondan sonra Süleymanın öldüyü vaxtı bilmək istədilər. Qurdu götürüb ağacın içinə saldılar. Bir gün, bir gecə o ağacdan yedi. Bu şəkildə hesab edib gördülər ki, Süleyman 1 il bundan əvvəl ölübdür. Hekayə uzundur, mən həqir müxtəsər bəhs etdim. Bundan başqa əlahiddə sözlər də bəhs ediblər, onları danışmağa çəkindim. Görəsən, belə qaynaqsız, məntiqsiz sözləri danışmağa onları nə vadar edib və səbəbi nədir? Doğrusunu Allah bilir. Ola bilməz ki, Süleymanın əsasına qurd onun ölümündən bir il əvvəl düşsün? Əsaya söykəndiyi halda, necə ki, başqa şəxsləri ölüm qəflətən tutar, onu da qəflətən ölüm tutub, ruhu alınıb, qurdun yeməyindən əsa sınıb, yıxılıb ölümü aşkar olsun? Bəs bu, bir qeyri-mümkün işdirmi? Belə ki, mənasız və mövhumat sözlərə yapışıb, mübarək ayəni fəsahət və bəlağət ecazından məhrum edərlər.**

**Allah-Təala ancaq "qurd onun ölümünü işarə etdi"dən başqa bir söz demir. Süleyman Misir fironunun qızı ilə evlənmişdi. Misirdən mahir ustaları cəlb edib, özündən ötrü uca qəsrlər və nəfis sənət əsərləri tərtib etdirib, Beytül-müqəddəsin zinətini artırdı. Bəni-İsrail elmsiz, cahil və nadan bir tayfa olduğu üçün o ustaların sənəti onlar üçün gizli qalıb, o elmlərdən heç bir şey dərk edə bilmirdilər. Onların elmləri xalqa gizli qalmışdı, hər bir mahir və zirək şəxsi, bu dövrdə də olduğu kimi, cinə oxşadıb, deyirdilər ki, filankəs cin kimidir, o ustalara da adət üzrə cin deyilmişdi. Xüsusən, keçmiş dövrlərdə adət olduğu kimi, Süleymanın da**

لَقَدْ كَانَ لِسَبَإٍ فِي مَسْكَنِهِمْ اٰيَةٌۚ جَنَّتَانِ عَنْ يَمِينٍ وَشِمَالٍۜ كُلُوا مِنْ رِزْقِ رَبِّكُمْ وَاشْكُرُوا لَهُۜ بَلْدَةٌ
طَيِّبَةٌ وَرَبٌّ غَفُورٌ ﴿١٥﴾ فَاَعْرَضُوا فَاَرْسَلْنَا عَلَيْهِمْ سَيْلَ الْعَرِمِ وَبَدَّلْنَاهُمْ بِجَنَّتَيْهِمْ جَنَّتَيْنِ ذَوَاتَيْ
اُكُلٍ خَمْطٍ وَاَثْلٍ وَشَيْءٍ مِنْ سِدْرٍ قَلِيلٍ﴿١٦﴾

---

**zorakı hakimiyyətinə məcburən tabe olan sənət əhli onun ölümünə şad olub, vətənlərinə dönəcəkləri üçün iş əzabından xilas olub qurtuldular. Bunu bir kənara qoyub mübarək ayəyə qeyri-məlum və məntiqsiz yorumlar yükləmək Allah-Təala və uca peyğəmbərin təyin etdiyi yoldan çox uzaqdır. Ağıl sahiblərinə bu işləri düşünmək tövsiyə edilir.**

**Səba Yəmən məmləkətində yerin adıdır, İbn Abbas deyir: "Səba Sənadan 3 "fərsəx"** (1 fərsəx 4444 m.) **uzaqlıqda bir yerin adıdır. O yerdə su az olurdu. Böyük Loğman iki dağın arasına sədd çəkdi, hansı ki yağış yağanda onlardan şiddətlə sel gəlirdi, o iki dağın arasında sellərdən cəm olan sudan bir böyük dəryaça təşkil etdi. Səba yeri münbit bir yer olduğu üçün o suyun səbəbinə gözəl bağlar təşkil edib və o bağlarda müxtəlif yerlərdən gətirilən hər bir növ meyvələrdən yetişdirdilər. Allah-Təala hər bir neməti onlara verdi, getdikcə məmləkətləri abad olub hər bir cəhətdən abadlaşdı. O camaat nəfslərinə tabe olub, fəsad və günahdan ləzzət aldıqları üçün Allah-Təalaya asi olub, azğınlaşıb, doğru yoldan sapdılar. Allah-Təala onlara dalbadal 13 peyğəmbər göndərdi. Hamısını təkzib edib, itaət etmədilər. Allah-Təala öz kamil qüdrəti ilə həmin səddi xarab edib, onun suyunu onlara bəla etdi. Onların evlərini, bağlarını darmadağın edib pis hala saldı. Sıradakı ayələrdə Allah-Təala bu qissəni xəbər verir. Allah-Təalanın nemətinə şükür etməyənlərin cəzası budur).**

**15)** (لَقَدْ كَانَ لِسَبَإٍ فِي مَسْكَنِهِمْ اٰيَةٌۚ جَنَّتَانِ عَنْ يَمِينٍ وَشِمَالٍۜ) - (Ey Məhəmməd), **həqiqətən Səba camaatından ötrü onların yaşadığı yerlərdə onlar üçün Allah-Təalanın tövhid və qüdrətinə dəlil, sübut var idi. O dəlil, sübut bu idi ki, Allah-Təala onlara mükəmməl nemətlər verib, onların bölgələrinin sağ və sol tərəfini bağlar əhatə edib, bölgələri gözəlləşib, bağları hər bir gözəl meyvələrlə dolu idi.** (كُلُوا مِنْ رِزْقِ رَبِّكُمْ وَاشْكُرُوا لَهُ) **- Peyğəmbərlər onları Allah-Təala tərəfinə dəvət edib dedilər: "Rəbbiniz Allah-Təalanın ruzisindən yeyib ona şükür edin.** (بَلْدَةٌ طَيِّبَةٌ وَرَبٌّ غَفُورٌ) **- Sizin bu bölgəniz pak və nemətləri bol olan bir bölgədir və rəbbiniz Allah-Təala da tövbə və şükür edənləri bağışlayandır. Siz də tövbə edib, Allah-Təalaya şükür edin".**

**16)** (فَاَعْرَضُوا) **- Peyğəmbərlərin nəsihətlərindən uzaq olub Allah-Təalaya itaət etməyib kafir oldular.** (فَاَرْسَلْنَا عَلَيْهِمْ سَيْلَ الْعَرِمِ) **- Onların asi olması səbəbinə biz də (əvvəldə bəhs olunan) səddi dağıdıb şiddətli, səddə taqət edə bilməyən seli onlara göndərdik, o sel gedib onların bölgələrini və bağlarını xarab etdi.** (وَبَدَّلْنَاهُمْ بِجَنَّتَيْهِمْ جَنَّتَيْنِ ذَوَاتَيْ اُكُلٍ خَمْطٍ وَاَثْلٍ وَشَيْءٍ مِنْ سِدْرٍ قَلِيلٍ) **- Onların**

ذٰلِكَ جَزَيْنَاهُمْ بِمَا كَفَرُواۜ وَهَلْ نُجَازٖيٓ اِلَّا الْكَفُورَ ﴿١٧﴾ وَجَعَلْنَا بَيْنَهُمْ وَبَيْنَ الْقُرَى الَّتٖي بَارَكْنَا
فٖيهَا قُرًى ظَاهِرَةً وَقَدَّرْنَا فٖيهَا السَّيْرَۜ سٖيرُوا فٖيهَا لَيَالِيَ وَاَيَّامًا اٰمِنٖينَ ﴿١٨﴾ فَقَالُوا رَبَّنَا بَاعِدْ بَيْنَ
اَسْفَارِنَا وَظَلَمُوٓا اَنْفُسَهُمْ فَجَعَلْنَاهُمْ اَحَادٖيثَ وَمَزَّقْنَاهُمْ كُلَّ مُمَزَّقٍۜ

---

**o gözəl bağlarının əvəzinə iki başqa bağ (bağ demək istehzadır) verdik, hansı ki o bağlarda dadsız, acı meyvələr, meyvəsiz ağaclar var idi, yaxşı meyvələrdən bir az albalı var idi.** (Yenə Allah-Təala onlara rəhm edib, bir az albalı ağaclarını onlar üçün saxladı), **qalan meyvələr hamısı məhv oldu.**

**17) (ذٰلِكَ جَزَيْنَاهُمْ بِمَا كَفَرُواۜ) -** (Ey Məhəmməd), **bu bəla ki,** (Səba) **əhlinə göndərib nemətlərini fani etdik, (وَهَلْ نُجَازٖيٓ اِلَّا الْكَفُورَ) bu qisim cəzanı ancaq Allah-Təalaya kafir olan camaata verərik. Belə cəzaya onlar layiqdirlər.**

**18) (وَجَعَلْنَا بَيْنَهُمْ وَبَيْنَ الْقُرَى الَّتٖي بَارَكْنَا فٖيهَا قُرًى ظَاهِرَةً) -** (Səba) **camaatı ilə o kəndlərin arasındakı yerlərin əhalisinə bərəkət, nemət vermişdik.** (Səba ilə Şam - Suriya kəndlərini) **bir-birinə bitişik bölgələr etmişdik. Kəndlərin birindən baxan şəxsdən ötrü digər kənd görünürdü.** (Allah-Təala bu ayədə ki, Səba camaatına nemət verdiyini xəbər verir, Şamla Səba məlikəsinin yeri arasında bir-birinə bitişik abad kəndlər olduğu üçün Səba camaatı Şama ticarətə gedən zaman orada özlərinə lazım hər bir ləvazimat olduğuna görə heç bir azuqə və zəruri şeylər götürməyib, istirahətlə məşğul olurdular). **(وَقَدَّرْنَا فٖيهَا السَّيْرَۜ سٖيرُوا فٖيهَا لَيَالِيَ وَاَيَّامًا اٰمِنٖينَ) - Onların Şama olan ticarət səfərləri o kəndlərin içindən keçdiyi üçün gündüz bir kəndi gəzib, seyr edib, gecə başqa kənddə gecələyərdilər.** (Allah-Təala hər bir şeyi onlardan ötrü hazır edib istirahət və seyr etdikləri üçün onlara xitab edib buyurur:)

**- Neçə gün və neçə gecə məsafə qət edib ticarət üçün Şama gedirsiniz, siz Səba əhlinin nə ki, ehtiyacı var, o kəndlərdə vardır, gündüzlər gəzib, seyr edib, gecələr rahat olun, hər iki halda əmin və xatircəm olun, heç bir şeydən qorxunuz olmasın).**

**19) (فَقَالُوا رَبَّنَا بَاعِدْ بَيْنَ اَسْفَارِنَا) - Səba camaatı o kəndlərin əhlinə paxıllıq edib hər bir neməti ancaq özləri üçün istəyib, o kəndlərin əhlinin həlakını və nemətlərinin məhv olmasını arzu edib dedilər: (Ey bizim rəbbimiz, bizim Şama olan səfərimiz zamanı içindən keçdiyimiz kəndləri bir-birindən uzaq və xarab edib, əhalisini də həlak et. (وَظَلَمُوٓا اَنْفُسَهُمْ) - Səba camaatı tüğyan edib o kəndlərin həlakını istəməklə nəfslərinə zülm edib özlərinin məhvinə bais oldular. (فَجَعَلْنَاهُمْ اَحَادٖيثَ) - Özlərindən sonra gələn camaatlardan ötrü onları nümunə seçdik ki, onların əhvalatından ibrət alsınlar. (وَمَزَّقْنَاهُمْ كُلَّ مُمَزَّقٍۜ) - Onlara** (sel) **əzab göndərib xalqını pərən-pərən etdik, belə ki hər tayfa bir* başqa diyara gedib, daha onlardan ötrü bir məkana toplanmaq mümkün olmadı, (hətta ərəblər onları bir camaatın dağılma-**

﴿إِنَّ فِي ذَٰلِكَ لَآيَاتٍ لِّكُلِّ صَبَّارٍ شَكُورٍ﴾١٩

---

**ğına misal göstərib deyirdilər: (Təfərrəqu eyyadi səba) yəni filan camaat Səba camaatı kimi dağıldı). (إِنَّ فِي ذَٰلِكَ لَآيَاتٍ لِّكُلِّ صَبَّارٍ شَكُورٍ) - Həqiqətən,** (Səba) **camaatının hekayəsində günahları tərk edib, səbirli olan və Allah-Təalanın nemətlərinə şükür edənlərdən ötrü Allah-Təalanın qüdrət və tövhidinə dəlil, sübutlar vardır.**

*(*Qeyd:* *"Elə ki inadkar (Ərim) sel gəlib Səba camaatının kəndlərini və bağlarını xarab edib, bəzisi həlak oldu, qalanları da dağılıb, hər tayfa bir diyara getdilər. 1) Əzd 2) Xüzaə 3) Xüzeymə 4) Qəssan 5) Ləxm Bunlar Səba xalqından olan məşhur tayfalardırlar. Bunlardan başqa qeyri-məşhur tayfalar da olub, ətrafa dağılıb, hər tayfa bir bölgədə yerləşdi. Əzd tayfası gedib Əmmanda yerləşib, o yerləri abad edib, bir böyük tayfa olub, onlardan böyük şəxslər, şairlər və xətiblər meydana gəlib islamla şərəfləndilər. Xüzaə tayfası gedib Məkkə ətrafında Tihamə adlanan yerə yerləşib, işləri tərəqqi etdi. Məkkəli Qüreyş tayfasıyla savaşıb Qüreyşə qalib olub, Kəbənin hər bir işinə sahib oldular ki, peyğəmbərin böyük babası Əbdi-Mənafın atası Qusayy ibn Kilab Xüzaənin rəisiylə bir yerdə olarkən, o şəxs də son dərəcə içki düşgünü olduğu üçün Qusayy Kəbənin kilidini iki tuluq çaxıra alıb, son dərəcə sevinclə Məkkəyə gedib, Qüreyş camaatına xəbər verdi. Qüreyş camaatı şad olub, Qusayyı özlərinə rəis etdilər Amma Xüzaə rəisini öz şairləri həcv edib, öz aralarından onu qovub uzaqlaşdırdılar. Xüzeymə camaatı gedib İraq mülkündə (Kufə və Bəsrə) məkanının ətrafında məskən saldılar. Onlardan bir tarixi xəbər məlum olmayıbdır. Qəssan camaatı Şam yerinə gedib Bəlqa və Havran yerlərini işğal etdilər. Bu camaat qüvvət tapıb, özlərindən bir səltənət təşkil edib, bir müddət hakimiyyətlərində müstəqil qaldılar. Ondan sonra gah İran, gah Rum (Bizans) dövlətinin himayəsinə daxil oldular. Hənif (tək tanrılı) dini olan islamın zühuru zamanı Rumun himayəsində Cəbələ ibn Eyhəm adlı şəxs onlara sultan idi. Peyğəmbərdən sonra II xəlifə Ömər ibn Xəttabın zamanında Şam mülkündə olan savaşlarda həmin Cəbələ ibn Eyhəm Bizans ordusu ilə birlikdə müzəffər islam ordusuna qarşı savaşdı. Bizansa tabe olduqları üçün bütün Qəssan camaatı xristian idi. Axırda Rum qoşunu məğlub olub dağıldı, müsəlmanlar Şama sahib olanda Cəbələ ailəsi ilə Mədinəyə II xəlifənin hüzuruna gedib islamı seçdi. Həmin il xəlifənin əmri ilə, Cəbələ də onunla birlikdə Beytullaha (Allahın evi-Kəbə) getməyə niyyət etdilər. Məkkəyə varid olandan sonra Kəbəni təvafla məşğul oldular. Təvaf əsnasında söyüşkən Cəbələnin uzun donu arxadan Bəni-Firarə camaatından bir kişinin ayağının altında qalıb parçalandı. Cəbələ qəzəblənib, Beytullahın hörmətini tapdalayıb o kişiyə bir şillə vurdu. Onun ağzı və başı partlayıb qanı axdı. O kişi və camaatı gedib xəlifə Ömər ibn Xəttaba şikayət etdilər. Xəlifə Cəbələnin gətirilməsini əmr etdi.*

وَلَقَدْ صَدَّقَ عَلَيْهِمْ اِبْلِيسُ ظَنَّهُ فَاتَّبَعُوهُ اِلَّا فَرِيقًا مِنَ الْمُؤْمِنِينَ ﴿٢٠﴾ وَمَا كَانَ لَهُ عَلَيْهِمْ مِنْ سُلْطَانٍ اِلَّا لِنَعْلَمَ مَنْ يُؤْمِنُ بِالْاٰخِرَةِ مِمَّنْ هُوَ مِنْهَا فٖي شَكٍّ

---

*O saat Cəbələni hazır etdilər. Xəlifə onu buna görə məzəmmət etdi. Cəbələ qızarıb dedi: "Məgər padşah rəiyyəti vuranda ona ağır sözlər deyərlərmi?" Xəlifə dedi: "İslamda padşah, gəda bərabərdir. İndi ya gərək onlar sənə razılıq verib, səni əfv etsinlər, ya da ki qisas alsınlar". Dedi: "Ey xəlifə, rəiyəttən ötrü padşahdan qisas alınar?" Xəlifə dedi: "Sənə dedim, islamda padşah, gəda bərabərdir". O şəxs də bağışlamayıb qisas tələb etdi. Cəbələ o gecəni xəlifədən möhlət alıb həmin gecə Məkkədən çıxıb, qıraq yoldan qaçıb, Rumun paytaxtı Bizansa (İstanbul) getdi. Yenidən xristian olub həmin şəhərdə öldü. Ləxm tayfası İraqa gedib Kufədən neçə km. məsafədə iqamətgah düzəldib məskən saldılar. O camaat şücaətli və cəsur olduqları üçün qısa bir zamanda orada Hirə şəhərini salıb bir səltənət qurdular. Onlara Münzir sultanları deyilirdi. Amma həmişə İran dövlətinin himayəsində yaşadılar, rəsmi məzhəbləri isə xristianlıq idi. Onlar nəsilbənəsil Hirədə hakimiyyətdə qaldılar. Onların axırıncısı Numan ibnül-Münzir Hirədə sultan ikən onunla İran şahı Xosrov Pərviz arasında bir məsələ oldu. (Bu işi burada anlatmaq uzun işdir). Xosrov Pərviz onu tutub Xanqeyndə həbs edib, orada qətl etdi. (Münzirin səltənəti dağılandan sonra Sey camaatından İyas İbn Qubeys Hirədə sultan oldu. I xəlifə Əbu Bəkrin xilafəti zamanı "seyfullah" (Allahın qılıncı) Xalid ibn Vəlid Hirəni fəth edib İran dövlətinin hakimiyyəti oradan kənar oldu. Ağar tayfası gedib Yəsribdə (Mədinə) məskən saldılar. Onlardan biri Ömər ibn Amir idi. Onun övladı bir Evs, bir də Xəzrəcdən iki böyük (Evs-Xəzrəc) tayfası meydana gəldi. Bu iki tayfa Mədinədə çoxalıb, hər birindən neçə qəbilə yarandı. Allah-Təala onlara qüvvət və qüdrət verib nəsillərini artırdı. Allahın Rəsuluna kömək etmək üçün onları hazır etdi. Peyğəmbər Mədinəyə hicrət edəndən sonra onları "ənsar"lıqla (köməkçi) yad etdi. (Yəni islam dininin köməkçiləri). Həqiqətən, islam dininə kömək edib yayanlar onlar idi. Onların əhvalatını danışmağa ehtiyac yoxdur. Allah onlardan razı olsun).*

**20) (وَلَقَدْ صَدَّقَ عَلَيْهِمْ اِبْلِيسُ ظَنَّهُ) - Həqiqətən, iblis insan nəsli haqqında bəslədiyi zənnini reallaşdırdı.** (O, insanlığın əcdadı Adəmə vəsvəsə edən vaxt güman etmişdi ki, bu kişinin övladı özündən də zəif olub mənə tabe olarlar. İblisin bu gümanı reallaşdı, o, zəhmət çəkmədən insanlar ona tabe olur). **(فَاتَّبَعُوهُ اِلَّا فَرِيقًا مِنَ الْمُؤْمِنِينَ) - Adəmin nəsli iblisə tabe oldu, ancaq onlardan bir qrup mömin ona tabe olmadı.**

**21) (وَمَا كَانَ لَهُ عَلَيْهِمْ مِنْ سُلْطَانٍ اِلَّا لِنَعْلَمَ مَنْ يُؤْمِنُ بِالْاٰخِرَةِ مِمَّنْ هُوَ مِنْهَا فٖي شَكٍّ) - Şeytanın insan nəsli üzərində bir hakimiyyəti yoxdur, ancaq iman edən iman etməyəndən, şübhəsi olandan aralanıb fərqlənsin deyə, bu imkanı ona**

وَرَبُّكَ عَلٰى كُلِّ شَيْءٍ حَفِيظٌ ﴿٢١﴾ قُلِ ادْعُوا الَّذِينَ زَعَمْتُمْ مِنْ دُونِ اللّٰهِ لَا يَمْلِكُونَ مِثْقَالَ ذَرَّةٍ
فِي السَّمٰوَاتِ وَلَا فِي الْاَرْضِ وَمَا لَهُمْ فِيهِمَا مِنْ شِرْكٍ وَمَا لَهُ مِنْهُمْ مِنْ ظَهِيرٍ ﴿٢٢﴾ وَلَا تَنْفَعُ
الشَّفَاعَةُ عِنْدَهُ اِلَّا لِمَنْ اَذِنَ لَهُ حَتّٰى اِذَا فُزِّعَ عَنْ قُلُوبِهِمْ قَالُوا مَاذَا قَالَ رَبُّكُمْ قَالُوا الْحَقَّ

---

**verdik. (وَرَبُّكَ عَلٰى كُلِّ شَيْءٍ حَفِيظٌ) -** (Ey Məhəmməd), **sənin rəbbin Allah-Təala hər bir şeyə nəzarət edib, qeyd edəndir.** (Fasiq və mömінin əməllərini qeyd edib, axirətdə əməllərinə görə onlara cəza verəcəkdir).

**22) (قُلِ ادْعُوا الَّذِينَ زَعَمْتُمْ مِنْ دُونِ اللّٰهِ) -** (Ey Məhəmməd), **müşriklərə de ki, o şeylər ki, möhtac olduğunuzda Allah-Təaladan başqa, onlara ibadət edirsiniz, onlara da dua edib, ehtiyaclarınızı onlardan istəyin.** (Necə ki Allah-Təalaya dua edib, ehtiyaclarınızı onlardan istəyirsiniz), **görəsən, onlar sizin ehtiyaclarınızı həll edə bilərlərmi?**

**(لَا يَمْلِكُونَ مِثْقَالَ ذَرَّةٍ فِي السَّمٰوَاتِ وَلَا فِي الْاَرْضِ) - Heç vaxt onlar sizin ehtiyaclarınızı həll edə bilməzlər. Ondan ötrü ki, onlar göylərdə və yerdə nə xeyir, nə şər, nə fayda, nə zərər verə bilməzlər, bir zərrə ağırlığı qədər heç bir şeyə malik deyildirlər. Onlar sizin ehtiyaclarınızı necə həll edib, sizə mənfəət verə bilərlər? (وَمَا لَهُمْ فِيهِمَا مِنْ شِرْكٍ) - halbuki onların göylərin və yerin yaradılışında, onlara hakim olmada Allah-Təalaya heç bir şəriklikləri yoxdur, bəlkə Allah-Təala bütün varlığın işlərini müqəddəs varlığı ilə tək həll edər. (وَمَا لَهُ مِنْهُمْ مِنْ ظَهِيرٍ) - Və Allah-Təalaya onun işlərində sizin dəvət edib ibadət etdiyiniz şeylərin heç bir köməyi yoxdur. Onlarda “rəbblik”-aləmi idarə etmə sifəti olmadığı üçün siz onları dəvət edən zaman da sizin ehtiyacınızı həll edib kömək edə bilməzlər.**

**23) (وَلَا تَنْفَعُ الشَّفَاعَةُ عِنْدَهُ اِلَّا لِمَنْ اَذِنَ لَهُ) - Heç bir şəfaət edənin şəfaəti heç bir şəxsdən ötrü Allah-Təala yanında fayda verməz, ancaq o şəxs istisnadır ki, Allah-Təala o şəfaət edən şəxsə izin vermiş ola. Belə vaxtda şəfaət edənin şəfaəti şəfaət olunana fayda verər. (حَتّٰى اِذَا فُزِّعَ عَنْ قُلُوبِهِمْ) - Şəfaət olunmağı və şəfaəti qiyamət günündə arzulayan şəxslər qorxu içində gözləyərlər. Görəsən, şəfaətə izin veriləcəkdir, ya yox. Uzun zaman o halda durarlar ki, Allah-Təala tərəfindən özünün razı olduğu şəxslərdən ötrü şəfaət etməyə layiq olan şəxslərə izin gəlib qəlblərindən qorxu götürülənə qədər. (قَالُوا مَاذَا قَالَ رَبُّكُمْ) - Allah-Təala tərəfindən şəfaətə izin gələndə şəfaət intizarında olanların bəzisi digərlərinə deyərlər: “Rəbbiniz Allah-Təala nə buyurdu?” (قَالُوا الْحَقَّ) - Deyərlər: “Allah-Təala haqq olan kəlamı buyurub şəfaətə izin verdi”.** (O vaxt şəfaətlə müjdələnənlər deyər:) **ey müşriklər, şəfaətin necə olması haqqında ki, siz deyirsiniz bu bütlər bizdən ötrü qiyamət günündə şəfaət edəcəklər, görəsən, Allah-Təaladan izinsiz şəfaət edəcəklər, ya Allah-Təalanın izni ilə şəfaət edəcəklər? Əgər desəniz ki,**

ۚ وَهُوَ الْعَلِيُّ الْكَبِيرُ ﴿٢٣﴾ قُلْ مَنْ يَرْزُقُكُمْ مِنَ السَّمٰوَاتِ وَالْاَرْضِۜ قُلِ اللّٰهُۙ وَاِنَّٓا اَوْ اِيَّاكُمْ لَعَلٰى هُدًى
اَوْ فٖي ضَلَالٍ مُبٖينٍ ﴿٢٤﴾ قُلْ لَا تُسْـَٔلُونَ عَمَّٓا اَجْرَمْنَا وَلَا نُسْـَٔلُ عَمَّا تَعْمَلُونَ ﴿٢٥﴾ قُلْ يَجْمَعُ
بَيْنَنَا رَبُّنَا ثُمَّ يَفْتَحُ بَيْنَنَا بِالْحَقِّ وَهُوَ الْفَتَّاحُ الْعَلٖيمُ ﴿٢٦﴾

---

**Allah-Təaladan izinsiz şəfaət edəcəklər, bu məntiqsiz olan bir sözdür və əgər desəniz ki, Allah-Təalanın izni ilə şəfaət edəcəklər, bəs Allah-Təala özündən ötrü razı olmadığı şəriklərə şəfaət etməyə izin verərmi?) (وَهُوَ الْعَلِيُّ الْكَبِيرُ) - Uca və böyük, bütün məxluqata üstün və qalib olan Allah-Təaladır. Qiyamət günündə Allah-Təaladan izinsiz şəfaət etməyə heç bir nəfərdə qüdrət olmaz.**

**24) (قُلْ مَنْ يَرْزُقُكُمْ مِنَ السَّمٰوَاتِ وَالْاَرْضِۜ) -** (Ey Məhəmməd, müşriklərə de ki,) **göylərdən yağış göndərib, sizin üçün yerdən hər bir növ yeyəcəyi çıxardıb, sizə ruzi verən kimdir? (قُلِ اللّٰهُ) - De ki, Allahdır.** (Ey Məhəmməd), **müşriklər hərçənd qəlblərində təsdiq edirlər ki, ruzini verən Allah-Təaladır, amma inadlarından və şirkə olan məhəbbət onların ağızlarına yüyən vurub, haqqı danışa bilməzlər. Əgər həqiqəti təsdiq etsələr, din və məzhəbləri batil olar, sən onların əvəzinə de ki, əlbəttə, ruzini verən Allah-Təaladır. Onlar sənin bu sözünü inkar edə bilməzlər. Ondan sonra** (Ey Məhəmməd), **onlara de ki, (وَاِنَّٓا اَوْ اِيَّاكُمْ لَعَلٰى هُدًى اَوْ فٖي ضَلَالٍ مُبٖينٍ) - indi ki, bütün varlığa ruzi verənin kimliyi məlum oldu, belə olan halda, həqiqətən, Allah-Təalaya iman gətirən bizlər, ya da ki siz müşriklər, bu iki qrupdan biri, əlbəttə, hidayətdə, ya da ki, aşkar sapqınlıqdadır. (Bu mübarək kəlam insafın ən yüksək dərəcəsində vaqe olan kəlamdır, çünki demir: "Nən hidayətdəyəm, siz müşriklər isə sapqınlıq içindəsiniz".**

**25) (قُلْ لَا تُسْـَٔلُونَ عَمَّٓا اَجْرَمْنَا) -** (Ey Məhəmməd), **müşriklərə de ki, əgər bizdən bir xəta meydana gəlsə, qiyamət günündə bizim əvəzimizə siz sorğu-sual olunmayacaqsınız. (وَلَا نُسْـَٔلُ عَمَّا تَعْمَلُونَ) - Habelə hər bir əməl ki sizdən meydana gəlsə, sizin əvəzinizə biz sorğu-sual olunmayacağıq. Bəlkə hər bir şəxs öz əməlindən sorğu-sual olunar. Siz ki Allah-Təalaya şirk qoşursunuz, bu səbəbdən sorğu-sual olunacaqsınız.** (Bu kəlam öz insaf səviyyəsinə görə əvvəlki kəlamdan yüksəkdir. Çünkü günahı özlərinə, əməli müşriklərə isnad edir. Diqqət edilsin).

**26) (قُلْ يَجْمَعُ بَيْنَنَا رَبُّنَا ثُمَّ يَفْتَحُ بَيْنَنَا بِالْحَقِّ) -** (Ey Məhəmməd), **müşriklərə de ki, qiyamət günündə bizim rəbbimiz Allah-Təala bizlə sizi bir yerə yığıb, ondan sonra bizim aramızda haqq və ədalətlə hökm edib, heç bir şəxsə zülm etməyəcəkdir.** (O vaxt siz peşman olacaqsınız. Lakin peşmanlıq sizə fayda verməyəcəkdir), **(وَهُوَ الْفَتَّاحُ الْعَلٖيمُ) - hər bir hökmə agah olan və hökm edən Allah-Təaladır.**

قُلْ اَرُونِيَ الَّذِينَ اَلْحَقْتُمْ بِهِ شُرَكَٓاءَ كَلَّاۜ بَلْ هُوَ اللّٰهُ الْعَزِيزُ الْحَكِيمُ ﴿٢٧﴾

---

**27) (قُلْ اَرُونِيَ الَّذِينَ اَلْحَقْتُمْ بِهِ شُرَكَٓاءَ) -** (Ey Məhəmməd), **müşriklərə de: “O şeyləri ki Allah-Təalaya şirk qoşursunuz, onları mənə göstərin*. Bu şeyləri ki, Allah-Təalaya şərik sayırsınız, ar olsun sizə, gərək, belə cansız şeyləri Allah-Təalaya şərik saymayasınız. (كَلَّاۜ) Ey müşriklər, Allah-Təalaya şirk qoşmaq batildir, bu dindən qayıdıb, şirki tərk edib, müvəhhid olun. (بَلْ هُوَ اللّٰهُ الْعَزِيزُ الْحَكِيمُ) - Həqiqətən, məbud məxluqata qalib gələr, hər bir işin özündən hikmət üzrə meydana gəldiyi yeganə varlıq Allah-Təaladır. Bu sifətlər sizin Allah-Təalaya şərik saydığınız şeylərdə yoxdur. Bəs onlara necə ibadət edib, Allah-Təalaya şərik sayırsınız?**

*(***Qeyd:*** “Bu kəlam cənab İbrahimin (ə.s) kəlamının oxşarıdır. O vaxt ki atasına və xalqına dedi: “Bu surətləri və təsvirləri ki, Allah-Təalaya şərik sayırsınız, heyif olsun sizə ki, belə cansız şeyləri Allah-Təalaya şərik qoşursunuz”. Alicənab uca peyğəmbərimiz o cənabın övladıdır. Onun kəlamının oxşarını deyib, babası İbrahim kimi müşrikləri dinə dəvətdə möhkəm olub, gözəl yolla onları islama dəvət edir, haqqa dəvət edənlər, gərək, bu cənablardan təlim alıb, sapqınları haqq tərəfinə bu yolla dəvət etsinlər, nəinki söyüş və çirkin sözlərlə, kobud və sərt kəlmələrlə dəvət etməyi özlərinə şüar edib, sapqınların daha da sapıtmasına bais olsunlar. Bizim zəmanəmizdəki anlaşılmaz vaizlərin əksəriyyəti bu yolu özlərinə şüar edib Allah-Təalanın evində müsəlmanların minbərində əxlaqsız dillərini açıb, nurlu şəriət məsələlərində çirkin sözlər işlədib, özlərini xeyri əmr edən, şəri qadağan edən hesab edirlər. Bu kimi öyüd-nəsihətin səbəbi yenə də cəhalətdir. Mütləq cəhalətdir, hətta Qurani-Şərifin açıq-aşkar ayələrinə və onların ehtiva etdiyi nəsihətlərin ifadə tərzinə və üslubuna cahil olmaqdır. “Onlarla ən gözəl şəkildə mücadilə et” -ayəsinə və ondan başqa da nəsihət üçün varid olan açıq-aydın ayələrə agah olsalar, hər halda, bu gözəl yolun əvəzinə çirkin yolu özlərinə şüar edib, bu vəhşi camaatı daha da vəhşət və zəlalətə salmazlar. Bəs caizdirmi, müsəlmanların minbərində həcv və çirkin sözlər danışıb, kar kimi bağırıb, adını vəz qoyub, əslində, oyunla, hoqqabazlıqla məşğul olasan? Uca peyğəmbərin röya yolu ilə görüb rəvayət etdiyi:“Elə insanlar gördüm ki, mənim minbərimə meymunun cinsi əlaqə üçün qalxıb-enməsi kimi çıxırlar” -kəlamını bu zəmanənin vaiz adlanan bəzi insanlarına aid etmək daha layiqdir. Bu zamanda yer kürəsinin ortasında yerləşən islam ölkələrini xaraba qoyub, əhalini vəhşət və cəhalətə salan iki tayfadır. Biri bu kimi vaizlərdir və biri də təmiz əhli-beytin düşməni olub və onların ehtiramını pozub, onların müsibətlərindən sui-istifadə edib, nalayiq hərəkətləri onlara isnad edən tayfadır. O tayfanın adını çəkməkdən islam himayədarlarının qəlbi qaralıb, nəfəsləri daralıbdır. O tayfanın halları qeyrətli, dindar müsəlmanlara gizli deyildir. Allah izzətli və intiqam alandır.*

**وَمَٓا اَرْسَلْنَاكَ اِلَّا كَٓافَّةً لِلنَّاسِ بَشٖيرًا وَنَذٖيرًا وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ﴿٢٨﴾ وَيَقُولُونَ مَتٰى هٰذَا الْوَعْدُ اِنْ كُنْتُمْ صَادِقٖينَ ﴿٢٩﴾ قُلْ لَكُمْ مٖيعَادُ يَوْمٍ لَا تَسْتَاْخِرُونَ عَنْهُ سَاعَةً وَلَا تَسْتَقْدِمُونَ ﴿٣٠﴾ وَقَالَ الَّذٖينَ كَفَرُوا لَنْ نُؤْمِنَ بِهٰذَا الْقُرْاٰنِ وَلَا بِالَّذٖي بَيْنَ يَدَيْهِ وَلَوْ تَرٰٓى اِذِ الظَّالِمُونَ مَوْقُوفُونَ عِنْدَ رَبِّهِمْ يَرْجِعُ بَعْضُهُمْ اِلٰى بَعْضٍ الْقَوْلَ**

---

**28) (وَمَٓا اَرْسَلْنَاكَ اِلَّا كَٓافَّةً لِلنَّاسِ بَشٖيرًا وَنَذٖيرًا) -** (Ey Məhəmməd), **səni göndərmişik ki, ancaq cəmi insan nəslini Allah-Təalanın rəhməti ilə müjdələyib, əzabı ilə qorxudasan. Sənin peyğəmbərliyin bir tayfaya məxsus deyildir. Bəlkə, yer üzündə olan bütün Adəm nəslinə peyğəmbərsən.** (Bu mübarək ayənin hökmü ilə (Məhəmməd ibn Abdullah s.a.v.) bütün insan nəslinə peyğəmbər göndərilibdir. Bütün insan nəslinə göndərilən peyğəmbər, gərək, peyğəmbərliyini təbliğ etsin. Bəli, uca peyğəmbərimiz o zaman adət olduğu kimi, bəzilərinə şifahi yolla, bəzilərinə də məktubla elçi göndərib peyğəmbərliyini təbliğ etdi. Qurani-Şərifin bildirdiyinə görə, cənab İbrahim və Məhəmməddən (ə.s) başqa, bütün peyğəmbərlər öz xalqlarına, ya da bir tayfaya məxsus göndəriliblər. Bu mətləb bundan əvvəl keçən surələrin təfsirində təfsilatlı şəkildə bəhs edilibdir). **(وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ)** - (Ey Məhəmməd), **lakin xalqın əksəriyyəti agah olmayıb, cahillikləri səbəbi ilə sənə müxalifət edirlər.**

**29) (وَيَقُولُونَ مَتٰى هٰذَا الْوَعْدُ اِنْ كُنْتُمْ صَادِقٖينَ)** - (Ey Məhəmməd), **müşriklər səndən soruşub deyirlər ki, bu qiyamət günü ki bizə vəd edirsən, əgər doğru deyənsənsə, bizdən ötrü bəyan et. O vəd nə vaxt olacaq, qiyamət nə vaxt qopacaq?**

**30) (قُلْ لَكُمْ مٖيعَادُ يَوْمٍ لَا تَسْتَاْخِرُونَ عَنْهُ سَاعَةً وَلَا تَسْتَقْدِمُونَ)** - (Ey Məhəmməd), **müşriklər cəhalət və inadkarlıqları səbəbi ilə səndən bu sualı soruşduqları üçün onlara de ki, siz qiyaməti inkar edirsiniz. Amma sizdən ötrü elə bir gün müəyyən olunub, qərar verilibdir ki, o gün qəflətən gəlib sizi tutacaq, o gündən nə gec, nə tez qala bilməyəcəksiniz ki, onun əzabından xilas olasınız.** (Ola bilər ki, ayə qiyamətdən əvvəl vaqe olan Bədir savaşına işarədir).

**31) (وَقَالَ الَّذٖينَ كَفَرُوا لَنْ نُؤْمِنَ بِهٰذَا الْقُرْاٰنِ وَلَا بِالَّذٖي بَيْنَ يَدَيْهِ) - Kafir və müşriklər dedilər:** (Ey Məhəmməd), **əbədiyyən nə bu Qurana, nə də təsdiq etdiyin o kitablara ki, bu Qurandan əvvəl gəlib, əbədiyyən biz iman etmərik.**

**(وَلَوْ تَرٰٓى اِذِ الظَّالِمُونَ مَوْقُوفُونَ عِنْدَ رَبِّهِمْ يَرْجِعُ بَعْضُهُمْ اِلٰى بَعْضٍ الْقَوْلَ) -** (Ey Məhəmməd), **qiyamət günündə kaş görəsən, Allah-Təala o zalımları öz hüzurunda haqq-hesabdan ötrü saxlayıb, onlar da bir- biri ilə qovğa edib, bir-birilərinə söz atıb, bir-birilərini günahkar saymaq istəyərlər, hər halda** (ey Məhəmməd), **bir təəccüblü iş görərsən,** (Onlardan hər bir şəxsin özünü günahsız sayıb, yoldaşını günahkar etməsi təəccüblü iş deyilmi?)

يَقُولُ الَّذِينَ اسْتُضْعِفُوا لِلَّذِينَ اسْتَكْبَرُوا لَوْلَآ اَنْتُمْ لَكُنَّا مُؤْمِنِينَ ﴿٣١﴾ قَالَ الَّذِينَ اسْتَكْبَرُوا لِلَّذِينَ
اسْتُضْعِفُوٓا اَنَحْنُ صَدَدْنَاكُمْ عَنِ الْهُدٰى بَعْدَ اِذْ جَآءَكُمْ بَلْ كُنْتُمْ مُجْرِمِينَ ﴿٣٢﴾

---

**(يَقُولُ الَّذِينَ اسْتُضْعِفُوا لِلَّذِينَ اسْتَكْبَرُوا لَوْلَآ اَنْتُمْ لَكُنَّا مُؤْمِنِينَ) - Onlar bir-biri ilə qovğa edib bir-birini bu şəkildə günahkar sayıb, zəif olanları** (tabe olanlar) **böyük olanlara** (rəislərə) **deyərlər: "Hər halda, əgər siz olmasaydınız, əlbəttə, biz Allah-Təalanı təsdiq edib müvəhhid şəxslərdən olardıq. Allah-Təala və onun peyğəmbərinə iman etməyimizə siz mane oldunuz".**

**32) (قَالَ الَّذِينَ اسْتَكْبَرُوا لِلَّذِينَ اسْتُضْعِفُوٓا اَنَحْنُ صَدَدْنَاكُمْ عَنِ الْهُدٰى بَعْدَ اِذْ جَآءَكُمْ) - Rəislər zəiflərə** (tabe olanlara) **deyərlər: "Guya, siz hidayətə gəlib, iman etməyə niyyət edəndən sonra biz sizi məcbur edib imana daxil olmanıza mane olduq? Bizdən belə bir iş meydana gəlməyib. (بَلْ كُنْتُمْ مُجْرِمِينَ)* - Bəlkə siz özünüz Allah-Təalaya asi və nəfsinizə tabe olub imanı tərk etdiniz? Bizə itaət etdiyinizə görə imanı tərk etmədiniz".**

*(*Qeyd:* *Qiyamət gününün ab-havası elə bir səviyyədədir ki, kafir və müşriklər, asilər özlərinin küfr və günahlarını özgə şəxsə isnad etməklə, bəlkə də istəyirlər əzablarını yüngülləşdirsinlər, o günün tədarükünü gərək dünyada ikən edəsən ki, qorxudan xilas olasan. O günün qorxusundan xilas olmaq iki şəkildə mümkün olar. Birincisi, cəmi ümmət ilə bir yerdə olub, bu sayədə özlərini o qorxudan xilas edələr, bu, nəfsin istəklərinə müxalif olub, haramı tərk edib, fərzlərə əməl etməkdir. Bu işdə hamı ortaqdır, amma bir qrupa xüsusi olaraq aiddir. Özü də əhəmiyyətli və vacibdir. O qrup varlılardır. O iş də din və məzhəbi qoruyub, millətin övladlarının rifahı və ehtiyaclarını həll etmək üçün onların var-dövlət xərcləməsidir. Din və millət də elmlə abad olar. Cahil və heyvan kimi nadan millətdən heç bir fayda hasil olmaz. Allahın peyğəmbərlərə kitab verib xalqa göndərməsindəki məqsəd onları cəhalətdən xilas edib elm və hidayətə vasil etməkdir. Millət arasında elmin rəvac tapmasının əsas səbəbi (sarı və ağ) var-dövlətdir. Onlar da hər bir şəhər və kənddə bir neçə müəyyən şəxsə aid olub, digərlərinin də gözü onlara dikilib. Allaha həmd olsun, bizim millətdə, mollalar arasında ülfət sahibi şəxslər mövcuddur, onların bəzilərindən xeyir əməllər və millətə xidmət görülsə də, əksəriyyəti var-dövlət yığıb xəzinələrini doldurmaqdan başqa, bir şey onlarda müşahidə olunmur. Görəsən onların özlərinə Quran əhli deməsi ancaq dil ilədir? Əslində, Qurani-Şərifə etiqad etməyiblərmi ki, onun açıq-aydın ayələrində necə birlik və gözəlliklər əmr olunub, necə onların tərkinə əzab vədi verilibdir? Ya da ki keçmiş dövrlərin müsəlmanlarından miras qalan xeyirli əsərlərə baxıb qeyrətə gəlmirlər ki, onlarda da keçmiş insanlar kimi islam qeyrəti, din və millət məhəbbəti zühura gəlsin, ya da bir xidmət edib tarixin səhifələrində yadigar qalsın? Varlı bir şəxs ki ondan heç bir xeyir*

وَقَالَ الَّذِينَ اسْتُضْعِفُوا لِلَّذِينَ اسْتَكْبَرُوا بَلْ مَكْرُ الَّيْلِ وَالنَّهَارِ اِذْ تَاْمُرُونَنَٓا اَنْ نَكْفُرَ بِاللّٰهِ وَنَجْعَلَ لَهُ اَنْدَادًاۜ وَاَسَرُّوا النَّدَامَةَ لَمَّا رَاَوُا الْعَذَابَۜ وَجَعَلْنَا الْاَغْلَالَ فٖٓي اَعْنَاقِ الَّذٖينَ كَفَرُواۜ هَلْ يُجْزَوْنَ اِلَّا مَا كَانُوا يَعْمَلُونَ﴿٣٣﴾ وَمَٓا اَرْسَلْنَا فٖي قَرْيَةٍ مِنْ نَذٖيرٍ اِلَّا قَالَ مُتْرَفُوهَٓاۙ اِنَّا بِمَٓا اُرْسِلْتُمْ بِهٖ كَافِرُونَ﴿٣٤﴾

---

*əməl meydana gəlməsin, onun fikrini hara yozmaq olur? Mən həqir cəsarət edib deyirəm, varlıların var-dövlət yığıb xəzinə toplamaları dərmanı olmayan cəhalət xəstəliyindəndir. Mən həqirin elm və cəhalət deməkdən məqsədi ancaq oxuyub-oxumamaq deyildir. Çox oxuyan şəxslər özləri cəhalət aləminə qərq olub, başqalarını da cəhalətə vadar edirlər. Uca peyğəmbərimiz oxyub yazmağı bilmirdi, amma o elm ki o cənabdan bizə gəlib, başqa heç bir peyğəmbərdən gəlməyib. Məncə, oxumaq elə olmalıdır ki, cəhalət və nadanlığı elmə mərifətə çevirsin. Bəs hansı elmi və necə oxuyaq? Bu məqamda qələm çaşqın qalıb, iş əql sahibi şəxslərin haqqı bilən düşüncələrinə həvalə olundu.*

*Mənim ürəyimdə elə bir dərd vardır ki, əgər desəm, dilim yanar,*
*Yox əgər gizlətsəm, qorxuram ki, sümüyümün içində iliyim yanar.*

*Hidayəti verən Allahdır).*

**33) (وَقَالَ الَّذِينَ اسْتُضْعِفُوا لِلَّذِينَ اسْتَكْبَرُوا بَلْ مَكْرُ الَّيْلِ وَالنَّهَارِ) - Zəiflər** (tabe olanlar) **rəislərə cavab verib dedilər: "Bizim asi və müşrik olmağımızın səbəbi biz yox, siz olmusunuz. Gecə və gündüz bizi aldadıb, bizi küfr və şirkə vadar edirdiniz. (اِذْ تَاْمُرُونَنَٓا اَنْ نَكْفُرَ بِاللّٰهِ وَنَجْعَلَ لَهُ اَنْدَادًاۜ) O zaman ki Allah-Təalaya kafir olub ona şirk qoşmağı bizə əmr edirdiniz, bəs bunları unutmusuzmu? Bizi zəlalətə siz vaqe edib indi inkar edirsiniz".**

**(وَاَسَرُّوا النَّدَامَةَ لَمَّا رَاَوُا الْعَذَابَ) -** (Ey Məhəmməd), **qiyamət günündə rəislər və onlara tabe olanlar o zaman ki, əzaba düçar oldular, dünyada etdikləri əməllərinə görə peşman olduqları haqqında öz aralarında gizlincə danışarlar.**

**(وَجَعَلْنَا الْاَغْلَالَ فٖٓي اَعْنَاقِ الَّذٖينَ كَفَرُواۜ) - Peşman olmaları onlara fayda verməyib, hamısını cəhənnəmə daxil edib, kafirlərin əllərini boyunlarına cəm edib, boyunlarına elə zəncir vurarıq ki, onlardan ötrü hərəkət etmək mümkün olmasın. (هَلْ يُجْزَوْنَ اِلَّا مَا كَانُوا يَعْمَلُونَ) Onlara ancaq dünyada etdikləri əməllərinə görə cəza verilər.**

**34) (وَمَٓا اَرْسَلْنَا فٖي قَرْيَةٍ مِنْ نَذٖيرٍ اِلَّا قَالَ مُتْرَفُوهَٓاۙ اِنَّا بِمَٓا اُرْسِلْتُمْ بِهٖ كَافِرُونَ) -** (Bu mübarək ayədə Allah-Təala peyğəmbərə təsəlli verib buyurur: "ey Məhəmməd), **xalqın səni təkzib etdiyi üçün ürəyini sıxma, səndən əvvəl hansı bölgəyə hansı peyğəmbəri ki, göndərdik, o bölgənin rəisləri və varlıları o peyğəmbərləri təkzib edib onlara dedilər: "Həqiqətən, o hökmlər ki siz güman edirsiniz ki, Allah-Təala tərəfindən bizə göndərilibsiniz, biz o hökmlərə kafir ol-**

وَقَالُوا نَحْنُ اَكْثَرُ اَمْوَالًا وَاَوْلَادًاۙ وَمَا نَحْنُ بِمُعَذَّبِينَ ﴿٣٥﴾ قُلْ اِنَّ رَبِّي يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَآءُ
وَيَقْدِرُ وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ ﴿٣٦﴾ وَمَآ اَمْوَالُكُمْ وَلَآ اَوْلَادُكُمْ بِالَّتِي تُقَرِّبُكُمْ عِنْدَنَا زُلْفٰى
اِلَّا مَنْ اٰمَنَ وَعَمِلَ صَالِحًاۘ فَاُولٰٓئِكَ لَهُمْ جَزَآءُ الضِّعْفِ بِمَا عَمِلُوا وَهُمْ فِي الْغُرُفَاتِ اٰمِنُونَ ﴿٣٧﴾
وَالَّذِينَ يَسْعَوْنَ فِيٓ اٰيَاتِنَا مُعَاجِزِينَ اُولٰٓئِكَ فِي الْعَذَابِ مُحْضَرُونَ﴿٣٨﴾

---

**duq.** (Necə ki ey Məhəmməd, sənin tayfan olan Qüreyş camaatı sən gətirən hökmləri qəbul etməyib, sənə kafir oldular, hər peyğəmbərin ümməti onlarla bu cür rəftar ediblər, onlar səbir edib axırda kafirlərə qalib oldular, sən də səbir et. Axırda onlara qalib gələcəksən).

**35) (وَقَالُوا نَحْنُ اَكْثَرُ اَمْوَالًا وَاَوْلَادًاۙ وَمَا نَحْنُ بِمُعَذَّبِينَ) - Rəislər və varlılar peyğəmbərlərə dedilər: "Siz peyğəmbərlərdən və sizə tabe olanlardan bizim mal və övladımız daha çoxdur, əgər Allah-Təala bizdən razı olmasaydı, bu mal və övladı bizə verməzdi, bu səbəbdən, biz Allah-Təala yanında əziz və hörmətli olduğumuza görə, bizə əzab etməyəcəkdir. Daha nəyə görə, biz sizə tabe olaq?"**

**36) (قُلْ اِنَّ رَبِّي يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَآءُ وَيَقْدِرُ) -** (Ey Məhəmməd), **müşriklərə de ki, ruzinin artıq olmağı Allah-Təalanın məmnunluğuna işarə etməz, həqiqətən, mənim rəbbim Allah-Təala hikmət və məsləhəti üzrə hər bir mömin və kafir şəxsi ki, istəsə, ruzini bol verib firavan edər, hər bir mömin və ya kafir şəxsdən ötrü də istəsə, dar edər, küfr və iman ruzinin artımına və ya azalmasına bais olan işlərdən deyil. (وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ) Lakin xalqın əksəriyyəti öz cəhalətlərindən ruzi və övladlarının çox olmağının səbəbini özlərinin Allah-Təalaya yaxınlıqları ilə izah edirlər.**

**37) (وَمَآ اَمْوَالُكُمْ وَلَآ اَوْلَادُكُمْ بِالَّتِي تُقَرِّبُكُمْ عِنْدَنَا زُلْفٰى) - Sizin mal və övladınız elə bir şey deyil ki, sizi bizim yanımıza yaxınlaşdırıb, onların səbəbinə əziz və hörmətli olasınız. (اِلَّا مَنْ اٰمَنَ وَعَمِلَ صَالِحًاۘ) Heç bir şəxs mal və övlad səbəbi ilə bizim yanımızda əziz və hörmətli olmaz, ancaq o şəxs ki iman edib, malını bizim yolumuzda, razı olduğumuz yerdə sərf edib, övladını xeyir əmələ vadar edib, elm və gözəl əxlaqı onlara təlim etsə, o vaxt mal və övladı onlara fayda verər, nəinki mal və övladı çox olan o şəxs ki, Allah-Təalaya özünü yaxın hesab edir) (فَاُولٰٓئِكَ لَهُمْ جَزَآءُ الضِّعْفِ بِمَا عَمِلُوا) Mal və övlad haqqında (bəhs olunan kimi) rəftar edənlərdən ötrü Allah-Təala yanında mükafat verilər (وَهُمْ فِي الْغُرُفَاتِ اٰمِنُونَ) və onlar cənnətin köşklərində hər bir cəhətdən əmin və xatircəm olduqları halda rahat olarlar.**

**38) (وَالَّذِينَ يَسْعَوْنَ فِيٓ اٰيَاتِنَا مُعَاجِزِينَ) - O şəxslər ki bizim ayələrimizi batil etməkdə səy edib, güman edirlər ki, bizi aciz edib əzabımızdan ölümlə qurtulacaqlar, (اُولٰٓئِكَ فِي الْعَذَابِ مُحْضَرُونَ) onlar qiyamət günündə cəhənnəm əzabında hazır olub xilas olmayacaqlar.**

قُلْ اِنَّ رَبّ۪ي يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ مِنْ عِبَادِه۪ وَيَقْدِرُ لَهُۜ وَمَٓا اَنْفَقْتُمْ مِنْ شَيْءٍ فَهُوَ يُخْلِفُهُۚ وَهُوَ خَيْرُ الرَّازِق۪ينَ ﴿٣٩﴾ وَيَوْمَ يَحْشُرُهُمْ جَم۪يعًا ثُمَّ يَقُولُ لِلْمَلٰٓئِكَةِ اَهٰٓؤُ۬لَٓاءِ اِيَّاكُمْ كَانُوا يَعْبُدُونَ ﴿٤٠﴾ قَالُوا سُبْحَانَكَ اَنْتَ وَلِيُّنَا مِنْ دُونِهِمْۚ بَلْ كَانُوا يَعْبُدُونَ الْجِنَّۚ اَكْثَرُهُمْ بِهِمْ مُؤْمِنُونَ ﴿٤١﴾

---

**39) (قُلْ اِنَّ رَبّ۪ي يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ مِنْ عِبَادِه۪ وَيَقْدِرُ لَهُ)** - (Ruzinin artıq və əskik olmağı Allah-Təalanın hikmət və məsləhətinə məxsus olduğu üçün bu mübarək ayə yenidən təkrarlandı). **Buyurur: "Müşriklərə de ki,** (ey Məhəmməd), **mənim rəbbim Allah-Təala öz bəndələrindən hansı şəxsdən ötrü, ruzini artıq və əskik edər, heç bir şəxs ona etiraz edə bilməz. (وَمَٓا اَنْفَقْتُمْ مِنْ شَيْءٍ فَهُوَ يُخْلِفُهُ) - Kim Allah-Təala yolunda xərcləyib, ehsan edib, ümmətin övladlarına xidmət etsə, dünya və axirətdə onun əvəzini verən Allah-Təaladır. Ondan başqa heç kim bunun əvəzini verməyə qadir deyildir. Onların əvəzini sizə verəcəkdir". (وَهُوَ خَيْرُ الرَّازِق۪ينَ) - Ruzi verənlərin yaxşısı və əlası Allah-Təaladır. Allah-Təaladan başqa ruzi verənlərin - sultandan ailəsinə ruzi verən kişilərə kimi hamısının verdiyi ruzi, həqiqətən, Allah-Təalanın ruzisidir. Onları vasitə təyin edib. Onların əli ilə vaqe edibdir. Ruzilərin hamısının yaradıcısı Allah-Təaladır. Səbəbləri yaradan da Allah-Təaladır. Səbəbi görüb, səbəbi yaradanı görməyən müşrikdir. İnsanın özündən ötrü düzəltdiyi səbəbləri Allah-Təala elə yox edər ki, insanın xəyalına gəlməz, ondan keçəndən sonra insanın ümidi qalmayıb, təsəvvürünə gəlməyən məqamdan ondan ötrü ağılı heyrətdə qoyan səbəblər yaradar, (Mövlana nə gözəl deyir:**

*Onun düzəltdiyi səbəbdən mən sevdalıyam,*
*Onun yandırmağı səbəbilə ustad olmuşam.*

**40) (وَيَوْمَ يَحْشُرُهُمْ جَم۪يعًا)** - (Ey Məhəmməd), **o gün ki,** (qiyamət günü) **cəmi insan nəslini bir yerə cəm edərik, (ثُمَّ يَقُولُ لِلْمَلٰٓئِكَةِ اَهٰٓؤُ۬لَٓاءِ اِيَّاكُمْ كَانُوا يَعْبُدُونَ) ondan sonra mələklərə ibadət edən şəxsləri azarlamaq və məzəmmət etməkdən ötrü mələklərə xitab edib deyərik: "Ey məlaikə, bəs bu şəxslər sizə ibadət edib sizi özlərinə məbud seçmişdilərmi?"**

**41) (قَالُوا سُبْحَانَكَ) -** (Mələklər bu xitabı eşidən kimi Allah qorxusu onları tutub, deyərlər): **"İlahi, sən pak və nöqsansızsan, səninlə birlikdə başqalarına da ibadət edilməkdən də uzaqsan, bizim məbud olmağa hansı ləyaqətimiz var? (اَنْتَ وَلِيُّنَا مِنْ دُونِهِمْ) - İlahi, biz sənə yaxınıq. Hər bir işimizin birinci sahibi sənsən, səni istəyərik, kafirlərlə bizim heç bir vəchlə necə ki, sən özün agahsan, yaxınlıq və dostluğumuz yoxdur. Onlar, həqiqətən, bizə ibadət etməyiblər. (بَلْ كَانُوا يَعْبُدُونَ الْجِنَّۚ اَكْثَرُهُمْ بِهِمْ مُؤْمِنُونَ) - Bəlkə, o kafirlər cinə, şeytana** (şəri əmr edən xəbis nəfslərinə) **sitayiş edib ağlı kənara qoyublar. İlahi, xalqın əksəriyyəti cin, şeytana iman edib, sənə iman etməkdən uzaq olublar.**

فَالْيَوْمَ لَا يَمْلِكُ بَعْضُكُمْ لِبَعْضٍ نَفْعًا وَلَا ضَرًّاۜ وَنَقُولُ لِلَّذِينَ ظَلَمُوا ذُوقُوا عَذَابَ النَّارِ الَّتِي كُنْتُمْ
بِهَا تُكَذِّبُونَ ﴿٤٢﴾ وَاِذَا تُتْلٰى عَلَيْهِمْ اٰيَاتُنَا بَيِّنَاتٍ قَالُوا مَا هٰذَآ اِلَّا رَجُلٌ يُرِيدُ اَنْ يَصُدَّكُمْ عَمَّا كَانَ
يَعْبُدُ اٰبَآؤُكُمْۚ وَقَالُوا مَا هٰذَآ اِلَّآ اِفْكٌ مُفْتَرًىط وَقَالَ الَّذِينَ كَفَرُوا لِلْحَقِّ لَمَّا جَآءَهُمْۙ اِنْ هٰذَآ اِلَّا سِحْرٌ
مُبِينٌ ﴿٤٣﴾ وَمَآ اٰتَيْنَاهُمْ مِنْ كُتُبٍ يَدْرُسُونَهَا وَمَآ اَرْسَلْنَآ اِلَيْهِمْ قَبْلَكَ مِنْ نَذِيرٍۜ ﴿٤٤﴾ وَكَذَّبَ
الَّذِينَ مِنْ قَبْلِهِمْ وَمَا بَلَغُوا مِعْشَارَ مَآ اٰتَيْنَاهُمْ فَكَذَّبُوا رُسُلِيۙ فَكَيْفَ كَانَ نَكِيرِۚ ﴿٤٥﴾

---

**42)** (فَالْيَوْمَ لَا يَمْلِكُ بَعْضُكُمْ لِبَعْضٍ نَفْعًا وَلَا ضَرًّاۜ) - (Ey Məhəmməd), **qiyamət günündə məhşər əhlinə deyərik: “Bugünkü gündə sizdən bəzisinin digərlərinə xeyir və zərər verməsinə qadir olmazsınız.**

**Bu günkü günün xeyir və mənfəəti bizim qüdrətli və məcbur edən əlimizdədir.** (وَنَقُولُ لِلَّذِينَ ظَلَمُوا ذُوقُوا عَذَابَ النَّارِ الَّتِي كُنْتُمْ بِهَا تُكَذِّبُونَ) **- Ogünkü gündə zalımlara deyərik: “Siz ki dünyada bu cəhənnəm əzabını inkar edib, təkzib edirdiniz, indi cəhənnəmə daxil olub, onun əzabını dadın”.**

**43)** (وَاِذَا تُتْلٰى عَلَيْهِمْ اٰيَاتُنَا بَيِّنَاتٍ) - (Ey Məhəmməd), **o zaman ki, bizim Qurani-Şərifin haqqa dəlil olan açıq-aşkar ayələrini bu müşriklərə qiraət etdik,** (الُوا مَا هٰذَآ اِلَّا رَجُلٌ يُرِيدُ اَنْ يَصُدَّكُمْ عَمَّا كَانَ يَعْبُدُ اٰبَآؤُكُمْ) **- o vaxt müşriklər dedilər: “Bu** (Məhəmməd) **bir kişidir ki, onun məqsədi sizi ata-babalarınızın ibadət etdiyi şeylərdən geri qaytarmaqdır.** (وَقَالُوا مَا هٰذَآ اِلَّآ اِفْكٌ مُفْتَرًى) **- və Quran haqqında dedilər: “Bu Quranı da (Məhəmməd) özündən düzəldib Allah-Təalaya iftira atır.** (وَقَالَ الَّذِينَ كَفَرُوا لِلْحَقِّ لَمَّا جَآءَهُمْۙ اِنْ هٰذَآ اِلَّا سِحْرٌ مُبِينٌ) **-Kafir və müşriklərə o zaman ki haqq olan Quran gəldi, dedilər ki, bu Quran açıq-aşkar sehrdir. Ona tabe olmaq layiq deyildir.**

**44)** (وَمَآ اٰتَيْنَاهُمْ مِنْ كُتُبٍ يَدْرُسُونَهَا) - (Ey Məhəmməd), **səndən əvvəl bu müşriklərə kitablar göndərməmişik ki, o kitabları oxuyub bir şey dərk etsinlər.** (وَمَآ اَرْسَلْنَآ اِلَيْهِمْ قَبْلَكَ مِنْ نَذِيرٍ) **- Və səndən əvvəl da onlara bir peyğəmbər göndərməmişik. Belə ki, səni təkzib edib, desinlər ki, sənin kitabın və sözlərin keçmiş peyğəmbərlərin kitablarına və sözlərinə ziddir. Bunlar gərək səni təsdiq edəydilər, səni təkzib etmələrinin heç bir əsası yoxdur.**

**45)** (وَكَذَّبَ الَّذِينَ مِنْ قَبْلِهِمْ) **- Bu müşriklərdən əvvəl yaşayan camaatlar da peyğəmbərlərini təkzib etdilər, necə ki bunlar səni təkzib edirlər.** (وَمَا بَلَغُوا مِعْشَارَ مَآ اٰتَيْنَاهُمْ) **- Bu müşriklər keçmiş müşriklərin uzun ömrünə, övlad və mallarının on hissədən bir hissəsinə hələ çatmayıblar.** (فَكَذَّبُوا رُسُلِيۙ فَكَيْفَ كَانَ نَكِيرِ) **- Onlar mənim peyğəmbərlərimi təkzib etdilər, o əzəmətli və qüvvətli müşrikləri gör ki, mənim əzabım onları necə tutdu. Bu müşriklər ki, hər bir cəhətdən onlardan əskik və zəifdirlər. Bunları da əlbəttə, mənim əzabım tutacaqdır.**

قُلْ اِنَّمَٓا اَعِظُكُمْ بِوَاحِدَةٍۚ اَنْ تَقُومُوا لِلّٰهِ مَثْنٰى وَفُرَادٰى ثُمَّ تَتَفَكَّرُواۜ مَا بِصَاحِبِكُمْ مِنْ جِنَّةٍۜ اِنْ هُوَ اِلَّا نَذٖيرٌ لَكُمْ بَيْنَ يَدَيْ عَذَابٍ شَدٖيدٍ ﴿٤٦﴾

---

**46) (قُلْ اِنَّمَٓا اَعِظُكُمْ بِوَاحِدَةٍۚ) -** (Ey Məhəmməd), **bu Qüreyş camaatına de ki, mən sizə bircə işi öyüd-nəsihət edirəm ki, mənim nəsihətimi qəbul edib o işdə çalışasınız. O işdə çalışmaq səbəbi ilə haqqa qovuşarsınız. (اَنْ تَقُومُوا لِلّٰهِ مَثْنٰى وَفُرَادٰى ثُمَّ تَتَفَكَّرُواۜ مَا بِصَاحِبِكُمْ مِنْ جِنَّةٍۜ) - O iş budur ki, Allah-Təalanın məmnunluğunu düşünüb, sırf Allah-Təaladan ötrü mərdi-mərdanə ona yönəlib, mənim bu işimi** (peyğəmbərlik işimi) **həqiqət üzrə təfəkkür edəsiniz. Bu böyük iş ki mən onu iddia edirəm, hansı ki o, dünya və axirət səltənətini ehtiva edir, belə bir işin iddiasına təşəbbüs edər o şəxs ki ya gərək dəli olsun. Onun haqqında deyilən sözlərdən kədərlənməyib, dediyi sözlərinə sübut istəndiyində də, aciz qalmağından utanmasın. Ya da ki, o şəxs ağıllı və kamil bir şəxs olub dünya əhlindən seçilib, ağılı da dünya əhlindən üstün olub peyğəmbərliyə layiq olsun. Ey Qüreyş camaatı, indi təfəkkür edib baxın, görün ki, bu Məhəmmədə dəlilik varmı? Halbuki siz özünüz agahsınız ki, bu Məhəmməd dəli deyildir. Bəlkə, siz özünüz onun ağılının üstünlüyünə, yumşaq xasiyyətinin möhkəmliyinə, zehninin gücünə, rəyinin haqlılığına və sözünün doğruluğuna, nəfsinin pak və təmizliyinə, gözəl sifətlərin hamısının onda cəm olmağına şahid olub təsdiq edirsiniz. Bəs belə olan halda, gərək, onun haqqında hüsni-rəğbət bəsləyib, onun doğruluğuna inanıb, Quran ayələrini onun haqlılığına kafi dəlil sayıb, Allah-Təala tərəfindən göndərilən haqq peyğəmbər olduğunu deyəsiniz. (اِنْ هُوَ اِلَّا نَذٖيرٌ لَكُمْ بَيْنَ يَدَيْ عَذَابٍ شَدٖيدٍ) - Bu** (Məhəmməd) **o şəxs deyil ki, şiddətli əzabdan** (qiyamət əzabından) **əvvəl sizi o əzabla qorxudub? Belə ki, müvəhhid olub o əzabdan xilas olasınız, belə bir şəxsin sözlərini inkar edib ona tabe olmamaq səfeh əməlidir, halbuki siz Qüreyş tayfası özünüzü ağıllı və kamil hesab edirsiniz,** (insaf və mərhəmətdən irəli gələn inci kimi sözlər Qüreyş camaatına necə ki bizim bu zamanda da onlar kimi inadkar şəxslərə, təsir etməyib, küfr və inadlarında davam etdilər).

**47) (قُلْ مَا سَاَلْتُكُمْ مِنْ اَجْرٍ فَهُوَ لَكُمْ) -** (Ey Məhəmməd), **müşriklərə de ki, mən ki, sizdən peyğəmbərliyi təbliğ etmək üçün bir mükafat istəməmişəm, əgər sizdən bir şey istəmiş olsam, o şey sizin olsun və halbuki, heç bir şey sizdən xahiş etməmişəm, (اِنْ اَجْرِيَ اِلَّا عَلَى اللّٰهِ) - mənim mükafatım Allah-Təaladandır. Başqa heç bir şəxsdən mükafat istəmirəm. (وَهُوَ عَلٰى كُلِّ شَيْءٍ شَهٖيدٌ) - Hər bir şeyi qoruyub, hər yerdə hazır olan və hər şeyi görən Allah-Təaladır. Sizdən mükafat istəməyib, malınızda tamahımın olmamasından Allah-Təala agahdır. Bəs niyə məndən qaçırsınız? Tamahkar* olmayıb, mükafat istəməyən vaiz və nəsihətçidən qaçmaq nadanlıqdır.**

قُلْ مَا سَأَلْتُكُم مِّنْ أَجْرٍ فَهُوَ لَكُمْ ۖ إِنْ أَجْرِيَ إِلَّا عَلَى اللَّهِ ۚ وَهُوَ عَلَىٰ كُلِّ شَيْءٍ شَهِيدٌ ﴿٤٧﴾ قُلْ إِنَّ
رَبِّي يَقْذِفُ بِالْحَقِّ عَلَّامُ الْغُيُوبِ ﴿٤٨﴾ قُلْ جَاءَ الْحَقُّ وَمَا يُبْدِئُ الْبَاطِلُ وَمَا يُعِيدُ ﴿٤٩﴾ قُلْ إِنْ
ضَلَلْتُ فَإِنَّمَا أَضِلُّ عَلَىٰ نَفْسِي ۖ وَإِنِ اهْتَدَيْتُ فَبِمَا يُوحِي إِلَيَّ رَبِّي ۚ إِنَّهُ سَمِيعٌ قَرِيبٌ ﴿٥٠﴾

---

***(*Qeyd:** “Həqiqətən də, vaiz və nəsihətçi olan şəxs, gərək, tamahkarlıqdan uzaq, nəsihət və vəzi Allah üçün olmuş olsun, belə şəxsin nəsihəti xalqa təsir edib, onları zəlalətdən hidayətə qaytarar. Tamahkar həmişə xalqın bəsit istəklərini düşünüb, haqqı pərdə arxasında gizlətsə, camaatın arzusuna görə danışsa, elə vaizlərin nəsihətinin fayda verməsi imkansızdır. Biz islam alimləri nə vaxta qədər ki, tamahkarlıq odunun içində yanırıq, onun şöləsi də bizi əhatə edir, bizdən ötrü xilas olmaq mümkün olmayacaqdır. Özlərini uca peyğəmbər Məhəmməd ibn Abdullahın (s.a.v) elçisi və canişini sayanların əksəriyyəti tamahkarlıqlarından Allahın hökmünü avam insanların arzusu ilə əvəz edirlər. Bəs belə nəsihətçi və vaizlərin sözlərindən millət nə fayda götürüb, haqqa necə vasil ola bilər? Müsəlmanların bir tayfasının pənahgahı və istinadgahı olan bir alimdən soruşurlar: “Bəs aşura günündə (imam Hüseynin (ə.s) qətl günü) xəncərlə baş yarmaq və digər vəhşi əməllər şəriətdə caizdir, yoxsa yox?” O rəis cavab verib deyir: “Bu mətləbə mən cavab verə bilmərəm, bunun cavabını gedib cənab Əbül-Fəzl Abbasdan soruşun. Bu cavaba dürüst diqqət edib görsünlər ki, bu bir kəlmə sözdən nə qədər cəhalət millət arasında yayılıb, necə şər və fəsada bais olan sözdür. Cənabın digər hökmləri və danışdığı sözlər də bu qəbildən sayılıb, diqqət ilə baxılsın. Ağıllıya bir işarə kafidir. İndi qələmi bu mətləbdə çox işlətməkdən saxlayıb, bir özgə vaxta həvalə etdim).*

**48) (قُلْ إِنَّ رَبِّي يَقْذِفُ بِالْحَقِّ عَلَّامُ الْغُيُوبِ) -** (Ey **Məhəmməd), de ki, qeybin işlərinə agah və xəbərdar olan mənim rəbbim Allah-Təaladır. Hər bir haqq olan əmri öz tərəfindən peyğəmbərlərinə göndərər.**

**49-50) (قُلْ جَاءَ الْحَقُّ وَمَا يُبْدِئُ الْبَاطِلُ وَمَا يُعِيدُ) -** (Ey Məhəmməd), **müşriklərə de ki, haqq** (mənim peyğəmbərliyim və Qurani-Şərif) **gəldi. Batil (**sizin dininiz və şərikləriniz) **bir şeyi nə əvvəlcədən, nə yenidən meydana gətirməyə qadir olmayıb məhv və yox oldular. (قُلْ إِنْ ضَلَلْتُ فَإِنَّمَا أَضِلُّ عَلَىٰ نَفْسِي) -** (Ey Məhəmməd), **müşriklərə de: “Siz ki məni zəlalətə isnad edib, deyirsiniz ki, ata-baba dinindən keçib zəlalətə vaqe olmuşam, əgər mən zəlalətə vaqe olmuşamsa, necə ki siz deyirsiniz, o zəlalətin zərərini mən öz nəfsimə yetirirəm, ondan sizə bir zərər-xeyir gəlməz. (وَإِنِ اهْتَدَيْتُ فَبِمَا يُوحِي إِلَيَّ رَبِّي) - Amma əgər mən hidayət tapıb dinim və yolum haqq olmuş olsa, o haqq Allah-Təalanın mənə Quran və hikmət vəhy etməsi səbəbi ilədir. Allah-Təala mənə Quran vəhy edib haqq tərəfinə hidayət edibdir”. (إِنَّهُ سَمِيعٌ قَرِيبٌ) - Həqiqətən, Allah-Təala bəndələrinə yaxındır. Zəlalətdə və ya hidayətdə**

وَلَوْ تَرٰىٓ اِذْ فَزِعُوا فَلَا فَوْتَ وَاُخِذُوا مِنْ مَكَانٍ قَر۪يبٍۙ ﴿٥١﴾ وَقَالُوٓا اٰمَنَّا بِه۪ۚ وَاَنّٰى لَهُمُ التَّنَاوُشُ مِنْ مَكَانٍ بَع۪يدٍۚ ﴿٥٢﴾ وَقَدْ كَفَرُوا بِه۪ مِنْ قَبْلُۚ وَيَقْذِفُونَ بِالْغَيْبِ مِنْ مَكَانٍ بَع۪يدٍ ﴿٥٣﴾ وَح۪يلَ بَيْنَهُمْ وَبَيْنَ مَا يَشْتَهُونَ كَمَا فُعِلَ بِاَشْيَاعِهِمْ مِنْ قَبْلُۜ اِنَّهُمْ كَانُوا ف۪ي شَكٍّ مُر۪يبٍ ﴿٥٤﴾

---

**olan hər bir şəxsin sözlərini və əməllərini dərk edib onlardan agahdır. Heç bir şey ona məxfi qalmaz.**

**51) (وَلَوْ تَرٰىٓ اِذْ فَزِعُوا) -** (Ey Məhəmməd), **qiyamət günü kaş görəsən müşrikləri və asiləri, o zaman ki qiyamət gününün qorxusu onları tutubdur. Hər halda böyük iş görərsən. (فَلَا فَوْتَ وَاُخِذُوا مِنْ مَكَانٍ قَر۪يبٍۙ) - Ogünkü gündə əzabdan qaçıb qurtula bilməyəcəklər. Bəlkə cəhənnəmə yaxın yerdən onlar tutulub əzabdan ötrü ora daxil ediləcəklər.**

**52) (وَقَالُوٓا اٰمَنَّا بِه۪ۚ) -** (Ey Məhəmməd), **o zaman ki bu müşriklər qiyamət gününün əzabını gördülər, o vaxt deyərlər:** (Məhəmmədə) **və gətirdiyi Qurana iman etdik. (وَاَنّٰى لَهُمُ التَّنَاوُشُ مِنْ مَكَانٍ بَع۪يدٍ) -** (Ey Məhəmməd), **müşriklər axirət günündə peşman olub iman edərlər, amma uzaq məkandan** (axirətdən) **onlardan ötrü asan yolla imanı qəbul edib, mömin olmaq necə mümkün olar? Halbuki qərib məkanda** (dünyada) **iman gətirmədilər** (dünya evi təklif yeri, axirət onun əksi olduğu üçün, dünya imandan ötrü qərib bir məkan, axirətsə uzaq bir məkan oldu).

**53) (وَقَدْ كَفَرُوا بِه۪ مِنْ قَبْلُۚ وَيَقْذِفُونَ بِالْغَيْبِ مِنْ مَكَانٍ بَع۪يدٍ) - Necə ola bilər ki, qiyamət günündə** (Məhəmmədə) **və Qurana iman etmək onlardan qəbul olunsun və halbuki qiyamət günündə əzabı görməkdən əvvəl dünyada** (Məhəmmədə) **və Qurana kafir oldular? Onlara uzaq olan məkana və məxfi qalan qeyb işlərinə şübhə ilə yanaşıb, ona sehrbaz, şair və yalançı deyirdilər və halbuki onun gətirdiyi Quran şeir və sehrdən tamamilə uzaq olub, özü də müşriklərin şəhadətinə görə,** (çünki neçə illər onların arasında yaşamışdı), **yalan və böhtandan uzaq idi, buna baxmayaraq, ona iman etməyib, küfr və inadlarında israr edib, təkzib etdilər, qiyamət günündə iman etmək onlara nə fayda verəcəkdir?**

**54) (وَح۪يلَ بَيْنَهُمْ وَبَيْنَ مَا يَشْتَهُونَ) -** (Ey Məhəmməd), **qiyamət günündə onların tövbələri qəbul olunmayıb, onlarla xahiş etdikləri iman və tövbə arasında hasar çəkilib, əzaba düçar olarlar, (كَمَا فُعِلَ بِاَشْيَاعِهِمْ مِنْ قَبْلُ) - necə ki, onlardan əvvəl yaşayan ümmətlərin müşriklərinə də onlar kimi əzab olunub. Qiyamət günündə tövbə və imanları qəbul olunmayacaq. (اِنَّهُمْ كَانُوا ف۪ي شَكٍّ مُر۪يبٍ) - Həqiqətən, müşriklər peyğəmbərlərin əmrinə şəkk-şübhə edib, özgələrini də şəkk-şübhəyə salırdılar. Belə şəxslərdən tövbə və iman necə qəbul olunar? Xüsusən, təklif yeri olan dünyadan köçəndən sonra.**

## *Səba surəsi*

**Allah-Təalaya həmd olsun. Səba surəsinin təfsiri tamam oldu. Allahın Rəsulu buyurubdur: "Kim Səba surəsini qiraət etsə, qiyamət günündə peyğəmbərlər ona yoldaş olub onunla salamlaşarlar". Əvvəlki surələrin bəzilərinin sonunda bu mətləbə işarə olunubdur ki, oxumaqdan məqsəd onun uca məzmununu təfəkkür edib, o surədə bəhs olunan elm və hikmətləri dərk etmək olmalıdır. Çünki oxumadan təfəkkür etmək mümkün olan iş deyil və bu səbəbdən surələrin oxunmasını əmr edir. Həm də təfəkkür etmədən oxumaq heç bir fayda verməyib, bəlkə, daha da bədbəxtliyə bais olar.**

## MƏLAİKƏ (FATİR) SURƏSİ

35-ci surədir. Məkkədə nazil olub, 45 ayə, 777 kəlmə və 3130 hərfdir.

اَلْحَمْدُ لِلّٰهِ فَاطِرِ السَّمٰوَاتِ وَالْاَرْضِ جَاعِلِ الْمَلٰئِكَةِ رُسُلًا اُولٖٓي اَجْنِحَةٍ مَثْنٰى وَثُلٰثَ وَرُبَاعَۜ يَزٖيدُ فِي الْخَلْقِ مَا يَشَٓاءُۜ اِنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَدٖيرٌ ﴿١﴾ مَا يَفْتَحِ اللّٰهُ لِلنَّاسِ مِنْ رَحْمَةٍ فَلَا مُمْسِكَ لَهَاۚ وَمَا يُمْسِكْۙ فَلَا مُرْسِلَ لَهُ مِنْ بَعْدِهٖۜ وَهُوَ الْعَزٖيزُ الْحَكٖيمُ ﴿٢﴾ يَٓا اَيُّهَا النَّاسُ اذْكُرُوا نِعْمَتَ اللّٰهِ عَلَيْكُمْۜ

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (اَلْحَمْدُ لِلّٰهِ فَاطِرِ السَّمٰوَاتِ وَالْاَرْضِ) - Cəmi həmd-səna edənlərin həmd-sənası göyləri və yeri yoxluqdan yaradan Allah-Təalaya məxsusdur. Əgər başqa şəxslərə də həmd olunsa, o həmdlərin əsl yönəlişi və mənası Allah-Təalayadır. (جَاعِلِ الْمَلٰئِكَةِ رُسُلًا) - Mələkləri yaradıb onları peyğəmbərlərə elçi göndərən Allah-Təaladır.**

**(اُولٖٓي اَجْنِحَةٍ مَثْنٰى وَثُلٰثَ وَرُبَاعَ) - Mələklərin bəzisi iki, bəzisi üç, bəzisi dört qanad sahibidirlər.** (Məlaikə və onların qanadları haqqında müxtəlif və çox-lu hədislər nəql edilibdir. O hədisləri anlatmağı münasib görməyib onlardan çəkindik. Ağıl gücü insan nəslində öz kamil səviyyəsinə çatdıqda onun kamil-lik dərəcəsinə görə, ondan ruhani qüvvələr və gözəl vəsflər meydana gələr. Şəriət dilində ağıl gücünə mələk və ondan meydana gələn digər qüvvələrə cin deyilir. Allah-Təala ağıl gücünün hərəkət sürətini və gizli mətləbləri dərk edib, anlamamız üçün onu qanad sahibi kimi təsvir edibdir). **(يَزٖيدُ فِي الْخَلْقِ مَا يَشَٓاءُ ) - Allah-Təala öz hikmətinə görə, nə qədər istəsə, məxluq yaradıb, onlara hüsn, görünüş və məlaikəyə hərəkət etmək üçün qanadlar bəxş edir. (اِنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَدٖيرٌ) - Həqiqətən, Allah-Təala hər bir şeyi yaratmağa qadirdir.**

**2) (مَا يَفْتَحِ اللّٰهُ لِلنَّاسِ مِنْ رَحْمَةٍ فَلَا مُمْسِكَ لَهَا) - Allah-Təala öz rəhmətindən** (ruzi, səhhət, şərəf və səltənət və elm) **hər bir şeyi ki xalqdan kiməsə vermək istəsə, heç bir nəfər onu tutub mane olmağa qadir olmaz.**

**(وَمَا يُمْسِكْۙ فَلَا مُرْسِلَ لَهُ مِنْ بَعْدِهٖ) - Və hər bir şeyi ki Allah-Təala saxlayıb xalqa verməyə mane ola, Allah-Təala onu tutandan sonra heç bir nəfər onu xalqa verməyə qadir olmaz, xeyir və mənfəət verib-verməməyə Allah-Təala qadirdir. (وَهُوَ الْعَزٖيزُ الْحَكٖيمُ ) - Rəhmətini xalqa verib-verməməyə Allah-Təala qadirdir. Hikmət və məsləhət üzrə xalqa bəxş edir və ya mane olur.**

**3) (يَٓا اَيُّهَا النَّاسُ اذْكُرُوا نِعْمَتَ اللّٰهِ عَلَيْكُمْ ) - Ey insan nəsli, Allah-Təalanın bu**

هَلْ مِنْ خَالِقٍ غَيْرُ اللّٰهِ يَرْزُقُكُمْ مِنَ السَّمَآءِ وَالْاَرْضِؕ لَآ اِلٰهَ اِلَّا هُوَۘ فَاَنّٰى تُؤْفَكُونَ ﴿٣﴾ وَاِنْ يُكَذِّبُوكَ فَقَدْ كُذِّبَتْ رُسُلٌ مِنْ قَبْلِكَؕ وَاِلَى اللّٰهِ تُرْجَعُ الْاُمُورُ ﴿٤﴾ يَٓا اَيُّهَا النَّاسُ اِنَّ وَعْدَ اللّٰهِ حَقٌّ فَلَا تَغُرَّنَّكُمُ الْحَيٰوةُ الدُّنْيَاٝ وَلَا يَغُرَّنَّكُمْ بِاللّٰهِ الْغَرُورُ ﴿٥﴾ اِنَّ الشَّيْطَانَ لَكُمْ عَدُوٌّ فَاتَّخِذُوهُ عَدُوًّاؕ اِنَّمَا يَدْعُوا حِزْبَهُ لِيَكُونُوا مِنْ اَصْحَابِ السَّعِيرِؕ﴿٦﴾

---

**dar dünyada sizə bəxş etdiyi çoxlu nemətlərini dillə və qəlblə zikr edib onlara şükür edin. (هَلْ مِنْ خَالِقٍ غَيْرُ اللّٰهِ يَرْزُقُكُمْ مِنَ السَّمَآءِ وَالْاَرْضِ) - Allah-Təalanın sizə bəxş etdiyi nemətlərə bir fikir verin. Bəs Allah-Təaladan başqa, bir əlahiddə yaradıcı varmı göylərdən yağış göndərib, sizdən ötrü yerdən hər bir növ nemətlər çıxardıb, sizə ruzi versin? Əlbəttə, Allah-Təaladan başqa, belə bir yaradıcı yoxdur. Bəs niyə Allah-Təalanın nemətlərini təfəkkür edib tövhidə gəlmirsiniz? (لَآ اِلٰهَ اِلَّا هُوَۘ فَاَنّٰى تُؤْفَكُونَ) - Allah-Təaladan başqa heç bir nəfər Haqq məbud yoxdur. Bəs tövhiddən qayıdıb hara dönürsünüz? Bəs Allah-Təalaya yalan isnad edib şirk qoşursunuz?**

**4) (وَاِنْ يُكَذِّبُوكَ فَقَدْ كُذِّبَتْ رُسُلٌ مِنْ قَبْلِكَ) -** (Ey Məhəmməd), **əgər bu Qüreyş camaatı səni təkzib edib sənə itaət etməsələr, peyğəmbərlər arasında təkzib olunan bir tək sən deyilsən. Bəlkə, səndən əvvəlki peyğəmbərləri də öz xalqları təkzib ediblər. Necə ki onlar səbir etdilər. Sən də səbir et. (وَاِلَى اللّٰهِ تُرْجَعُ الْاُمُورُ) - Cəmi işlərin qayıdacağı yer Allah-Təala tərəfinədir. Peyğəmbərləri təkzib edənlərin cəzasını onlara verəcəkdir.**

**5) (يَٓا اَيُّهَا النَّاسُ اِنَّ وَعْدَ اللّٰهِ حَقٌّ) - Ey insan nəsli, Allah-Təalanın vədi (qiyamət gününün vaqe olub, hər bir şəxsə əməlinin qarşılığını vermək) haqdır, əlbəttə, vaqe olacaqdır. (فَلَا تَغُرَّنَّكُمُ الْحَيٰوةُ الدُّنْيَا) - Dünya ləzzətlərilə məşğul olmaq sizi məğrur edib, aldadıb, axirət əməllərindən sizi qafil etməsin. (وَلَا يَغُرَّنَّكُمْ بِاللّٰهِ الْغَرُورُ) Şeytan** (pisliyi əmr edən nəfs) **sizi aldadıb Allah-Təalaya asi edib, onun sözlərinə inanmayın ki, Allah-Təala etdiyiniz böyük günahları bağışlayıb, kiçik günahları da əfv edər. Nəfsin bu sözünə itaət etməyin. Bəlkə Allah-Təala böyük günahları bilmədən edib, sonra da tövbəkar olarsınızsa, bağışlayar.**

**6) (اِنَّ الشَّيْطَانَ لَكُمْ عَدُوٌّ فَاتَّخِذُوهُ عَدُوًّا) - Həqiqətən, şeytan** (pisliyi əmr edən nəfs) **babanız Adəmə düşmən olan kimi sizə də düşməndir. Ağıllı şəxs düşməni ilə dostluq etməz. Siz də şeytanı düşmən sayıb, ona itaət etməyib, Allah-Təalaya asi olmayın. (اِنَّمَا يَدْعُوا حِزْبَهُ لِيَكُونُوا مِنْ اَصْحَابِ السَّعِيرِ) - Şeytan xəbis şeylərdən ibarət olan qoşununu dəvət edib sizə vəsvəsə edir, belə ki, xəbis şeyləri özünüzə şüar seçib, Allah-Təalaya asi olduğunuz üçün Allah-Təalanın sonsuz rəhmətindən kənara düşüb, cəhənnəmin alov və odunda əzab edilən şəxslərdən olasınız. Belə düşmənə ağıllı şəxs tabe olarmı?**

اَلَّذِينَ كَفَرُوا لَهُمْ عَذَابٌ شَدِيدٌ وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ لَهُمْ مَغْفِرَةٌ وَاَجْرٌ كَبِيرٌ ﴿٧﴾
اَفَمَنْ زُيِّنَ لَهُ سُوٓءُ عَمَلِهِ فَرَاٰهُ حَسَنًاۜ فَاِنَّ اللّٰهَ يُضِلُّ مَنْ يَشَآءُ وَيَهْدِي مَنْ يَشَآءُ فَلَا تَذْهَبْ نَفْسُكَ
عَلَيْهِمْ حَسَرَاتٍۜ اِنَّ اللّٰهَ عَلِيمٌ بِمَا يَصْنَعُونَ ﴿٨﴾ وَاللّٰهُ الَّذِيٓ اَرْسَلَ الرِّيَاحَ فَتُثِيرُ سَحَابًا فَسُقْنَاهُ اِلٰى
بَلَدٍ مَيِّتٍ فَاَحْيَيْنَا بِهِ الْاَرْضَ بَعْدَ مَوْتِهَاۜ كَذٰلِكَ النُّشُورُ ﴿٩﴾ مَنْ كَانَ يُرِيدُ الْعِزَّةَ فَلِلّٰهِ الْعِزَّةُ جَمِيعًاۜ

---

**7) (اَلَّذِينَ كَفَرُوا لَهُمْ عَذَابٌ شَدِيدٌ) - O şəxslər ki şeytana tabe olub, Allah-Təalaya kafir oldular, onlardan ötrü axirətdə şiddətli əzab vardır.**

**(وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ لَهُمْ مَغْفِرَةٌ وَاَجْرٌ كَبِيرٌ) - O şəxslər ki, Allah-Təala və onun peyğəmbərinə və Qurana iman etdilər, imanlarının səbəbinə onlardan ötrü Allah-Təala yanında bağışlanmaq və böyük mükafat vardır.**

**8) (اَفَمَنْ زُيِّنَ لَهُ سُوٓءُ عَمَلِهِ فَرَاٰهُ حَسَنًاۜ) -** (Ey Məhəmməd), **o şəxs ki ondan ötrü nəfsi yaman əməlinə zinət verib, onu gözəl əməl sayıb tərk etməsə, bu şəxs heç o şəxs kimi olar ki, nəfsə tabe olmayıb, yaman əməli onun nəzərində gözəl görünməsin? Yamanı yaman, yaxşını yaxşı görə, bəs bunların ikisi bərabər olarmı?** (Guya Allahın Rəsulu cavabda demiş ki, əlbəttə bərabər olmazlar), **o səbəbdən Allah-Təala növbəti ayədə ona cavab verir. (فَاِنَّ اللّٰهَ يُضِلُّ مَنْ يَشَآءُ وَيَهْدِي مَنْ يَشَآءُ فَلَا تَذْهَبْ نَفْسُكَ عَلَيْهِمْ حَسَرَاتٍۜ)-0-** (Ey Məhəmməd), **indi ki belədir, nəfsinə tabe olub zəlalətə vaqe olanların imana daxil olmaları üçün həsrət çəkib özünü həlak etmə. Həqiqətən, Allah-Təala hər bir şəxsi istəsə** (yaman əməl sahiblərini), **zəlalətlərində saxlayıb yardım qapısını onların üzünə bağlayar və hər bir şəxsi istəsə (yaxşı əməl sahiblərini), hidayət edib məqsədlərinə çatmada onları sabit və bərqərar edər. (اِنَّ اللّٰهَ عَلِيمٌ بِمَا يَصْنَعُون) Həqiqətən, Allah-Təala yaman əməl sahiblərinin əməllərindən agahdır və əməllərinin cəzasını onlara verəcəkdir.**

**9) (وَاللّٰهُ الَّذِيٓ اَرْسَلَ الرِّيَاحَ فَتُثِيرُ سَحَابًا) - Allah-Təala öz kamil qüdrəti ilə külləkləri göndərir, onların vasitəsilə bulud yaradıb, onlara hərəkət verib havada onları toplayar. (فَسُقْنَاهُ اِلٰى بَلَدٍ مَيِّتٍ فَاَحْيَيْنَا بِهِ الْاَرْضَ بَعْدَ مَوْتِهَاۜ) - Buludları bir yerə yığandan sonra onları sürüyüb apararıq, bir ölü olan yer tərəfə ki, onda bitkilərdən heç nə olmasın. O suyu onların yerinə göndərib, o suyun səbəbinə o yeri öləndən sonra dirildib, ona yeni həyat verib, bir gözəl şəklə salarıq. (كَذٰلِكَ النُّشُورُ) - Qiyamət günündə də insan cəsədlərinin dirilməsi bu ölü yerlərin dirilməsi kimidir. Necə ki Allah-Təala ölü yerləri diriltməyə qadirdir, habelə qiyamət günündə ölü bədənlərə yenidən həyat verib diriltməyə qadirdir. Bu iki diriltməyin arasında heç bir fərq yoxdur.**

**10) (مَنْ كَانَ يُرِيدُ الْعِزَّةَ فَلِلّٰهِ الْعِزَّةُ جَمِيعًاۜ) - Müşriklər bütlər düzəldib, onlara ibadət etməyi özlərindən ötrü izzət və şərəf hesab edib, özlərini xalq arasında əziz və möhtərəm sayırdılar, bu ayə onların iddiasını rədd edir.**

اِلَيْهِ يَصْعَدُ الْكَلِمُ الطَّيِّبُ وَالْعَمَلُ الصَّالِحُ يَرْفَعُهُ ۜ وَالَّذِينَ يَمْكُرُونَ السَّيِّـَٔاتِ لَهُمْ عَذَابٌ شَدِيدٌ ۜ
وَمَكْرُ اُو۬لٰٓئِكَ هُوَ يَبُورُ ﴿١٠﴾ وَاللّٰهُ خَلَقَكُمْ مِنْ تُرَابٍ ثُمَّ مِنْ نُطْفَةٍ ثُمَّ جَعَلَكُمْ اَزْوَاجًاؕ وَمَا تَحْمِلُ
مِنْ اُنْثٰى وَلَا تَضَعُ اِلَّا بِعِلْمِهٖؕ وَمَا يُعَمَّرُ مِنْ مُعَمَّرٍ وَلَا يُنْقَصُ مِنْ عُمُرِهٖٓ اِلَّا فٖي كِتَابٍؕ اِنَّ ذٰلِكَ
عَلَى اللّٰهِ يَسٖيرٌ ﴿١١﴾

---

**Kim, izzət və şərəf istəyib, xalq arasında əziz, möhtərəm olmağı arzu etsə, gərək, o şəxs Allah-Təalaya itaət edib, izzət və şərəfi Allah-Təaladan istəsin, həqiqətən, izzət və şərəf Allah-Təalaya məxsusdur. Hər bir şəxsi ki, Allah-Təala istəsə, əziz və möhtərəm edər. Allah-Təaladan başqa, bütlər və ya digərləri heç bir şəxsə izzət və şərəf bəxş edə bilməzlər. Gərək, siz müşriklər şirki tərk edib, Allah-Təalaya itaət edəsiniz ki, izzət və şərəf sahibi olasınız.** (Allah-Təala yanında əziz və möhtərəm olmaq iki şeylə mümkündür. Biri iman, o birisi xeyir əməl, biri olub, o birisi olmayanda, o şəxsdən ötrü Allah-Təala yanında izzət və hörmət olmaz. Necə ki, növbəti ayədə buyurur). **(اِلَيْهِ يَصْعَدُ الْكَلِمُ الطَّيِّبُ وَالْعَمَلُ الصَّالِحُ يَرْفَعُهُ) - Pak olan kəlmələr** (tövhid və peyğəmbərliyə aid olan elm və hikmət kəlmələri) **bilavasitə pak olduqları üçün Allah-Təalaya tərəf yüksələrlər, lakin xeyir əməlsiz qəbul edilməzlər, elə ki o kəlmələr xeyir əməl sahibi mömin şəxsdən zühur etdi, o xeyir əməl onun imanını ucaldıb, Allah tərəfindən qəbul edilməsinə səbəb olar. Allah-Təala yanında imanın qəbul olunmasının şərti xeyir əməldir. (وَالَّذِينَ يَمْكُرُونَ السَّيِّـَٔاتِ لَهُمْ عَذَابٌ شَدِيدٌ) - O şəxslər ki, günah etmədə hər cür məkr və hiylə edib, günah sahibi ola, onlardan ötrü Allah-Təala yanında şiddətli əzab vardır. (وَمَكْرُ اُو۬لٰٓئِكَ هُوَ يَبُورُ) - Onların məkr və hiylə edib, günaha batmaları batil və puç olub onlara zərər verər.**

**11) (وَاللّٰهُ خَلَقَكُمْ مِنْ تُرَابٍ) - Allah-Təala sizin babanız Adəmi torpaqdan yaratdı. (ثُمَّ مِنْ نُطْفَةٍ) Adəmi yaradıb Həvvanı ona yoldaş təyin edəndən sonra siz insan nəslinin davamını öz əzəli iradəsilə doğulma yolu ilə təyin edib,** (torpaqdan yaradılma uzun zaman tələb etdiyi üçün) **sizi spermadan yaratdı. Belə ki, ana bətnində tez inkişaf edib, dünya aləminə gələsiniz. (ثُمَّ جَعَلَكُمْ اَزْوَاجًا) - Ondan sonra Allah-Təala siz insan nəslini təbəqələrə bölüb, müxtəlif dillərə sahib edib, yer üzünə yaydı.**

**(وَمَا تَحْمِلُ مِنْ اُنْثٰى وَلَا تَضَعُ اِلَّا بِعِلْمِهٖ) - Heç bir qadın** (dişi) **Allah-Təalanın elminin xaricində hamilə olub doğmaz,** (hər bir qadının hamilə olub doğmasından Allah-Təala agahdır) **(وَمَا يُعَمَّرُ مِنْ مُعَمَّرٍ وَلَا يُنْقَصُ مِنْ عُمُرِهٖٓ اِلَّا فٖي كِتَابٍ) - Hər bir uzun ömür sürənin və ömrü** (bəzi səbəblərə görə) **qısaldılanın ömür müddəti "lövhi-məhfuz"da** (ilahi elmdə) **qeyd olunub, dəyişməz deyildir. (Allah-Təalanın elmində hər bir şəxsdən ötrü təyin olunan ömrü sonlandırma və ya bəzi səbəblərə görə, qısaltma Allah-Təalaya məxsus olub kimsə ondan agah deyildir. (اِنَّ ذٰلِكَ عَلَى اللّٰهِ يَسٖيرٌ) - Həqiqətən, ömrün uzunlu-**

وَمَا يَسْتَوِي الْبَحْرَانِۖ هٰذَا عَذْبٌ فُرَاتٌ سَآئِغٌ شَرَابُهُ وَهٰذَا مِلْحٌ اُجَاجٌۜ وَمِنْ كُلٍّ تَاْكُلُونَ لَحْمًا طَرِيًّا
وَتَسْتَخْرِجُونَ حِلْيَةً تَلْبَسُونَهَاۚ وَتَرَى الْفُلْكَ فِيهِ مَوَاخِرَ لِتَبْتَغُوا مِنْ فَضْلِهِ وَلَعَلَّكُمْ تَشْكُرُونَ ﴿١٢﴾
يُولِجُ الَّيْلَ فِي النَّهَارِ وَيُولِجُ النَّهَارَ فِي الَّيْلِۙ

---

**ğu və ya qısalığının qeyd olunması Allah-Təalanın elmi daxilində olub, Onun üçün asan olan şeydir.** (Kağıza, qələmə, mürəkkəbə ehtiyacı yoxdur), **belə ki, haqq-hesab tutmaq Allah-Təalaya çətin olsun. Bəlkə, surətlərin əksi aynada olduğu kimi, külli əşyanın elmi də Onun müqəddəs varlığında mövcuddur.**

**12) (وَمَا يَسْتَوِي الْبَحْرَانِۖ) -** (Ey Məhəmməd), **iki dəniz** (biri şirin, biri şor) **heç vaxt bir-biriylə bərabər və eyni olmazlar, şirin şorla necə eyni ola bilər?** (Bu mübarək ayə kafirlə mömin, cahillə alimdən ötrü məsəldir). **(هٰذَا عَذْبٌ فُرَاتٌ سَآئِغٌ شَرَابُهُ ) -** (Ey Məhəmməd), **baxıb görürsən ki, bu dənizin** (çayın) **suyu son dərəcə şirin, yanğını söndürən, içən zaman həzmi asan olub rahat şəkildə boğaza daxil olar.** (Nil və Dəclə, Ceyhun (Amudərya) kimi böyük çaylara ərəb dilində “bəhr”(dəniz) deyilir). **(وَهٰذَا مِلْحٌ اُجَاجٌۜ) - Bu biri dənizə baxıb görürsən ki, tamam şordur, içən zaman acılıqdan boğazı yandırar.**

**(وَمِنْ كُلٍّ تَاْكُلُونَ لَحْمًا طَرِيًّا) - Lakin bu iki dənizin hər ikisindən də təzə ət** (balıq) **çıxarıb yeyirsiniz. (وَتَسْتَخْرِجُونَ حِلْيَةً تَلْبَسُونَهَا) - Şor dənizdən zinətlər** (mərcan, mirvari) **çıxarıb, ondan başqa zinətlər düzəldirsiniz. (وَتَرَى الْفُلْكَ فِيهِ مَوَاخِرَ) -** (Ey Məhəmməd), **bəzilərini dəniz yolu ilə gəlib gedən görürsən. (لِتَبْتَغُوا مِنْ فَضْلِهِ وَلَعَلَّكُمْ تَشْكُرُونَ) - Bu nemətləri Allah-Təala sizə yetirib ki, gəmilərə minib, Allah-Təalanın lütf və mərhəmətindən ruzi istəyib və o ruzi ilə nemətlərə şükür edəsiniz.** (Hərçənd mənfəət və faydada hər iki dəniz (şirin və şor) bərabərdir, bəlkə, şorun faydası artıqdır, amma bununla birlikdə şor şirinə bərabər ola bilməz. Bir məqam olar ki, şəxs susuzluqdan yandığından cəmi malını bircə şirin suya xərcləyər ki, həlak olmasın. Bu fayda şor suda mövcud deyildir. (Habelə möminlə kafirin, alimlə cahilin məsəli, hərçənd kafir və cahil şəxslərdən də bəzi əməllər meydana gələr, lakin onların qəlbləri ölü olduqlarına görə, özləri də ölülərə aid olub, varlıq və yoxluqları eyni səviyyədədir. Bu ayə dənizdən çıxan balıqların pullu olsun, ya olmasın, fərqi yoxdur, halal olmağına işarə edir, bu səbəbdən islam ümmətindən bir böyük qrup ayəyə bağlı qalıb, dənizdən çıxan hər bir balığı halal sayarlar, amma bir digər qrup bəzi xəbərlərə və Tövratda açıq şəkildə bildirilən ayənin hökmünə tabe olub pulu olmayan balığı haram sayıb yemirlər).

**13) (يُولِجُ الَّيْلَ فِي النَّهَارِ وَيُولِجُ النَّهَارَ فِي الَّيْلِۙ) - Allah-Təala öz kamil qüdrəti ilə gecəni gündüzə qatıb, gecəni qısa, gündüzü uzun edər. Gündüzü**

وَسَخَّرَ الشَّمْسَ وَالْقَمَرَ ۘ كُلٌّ يَجْرِي لِاَجَلٍ مُسَمًّى ۜ ذٰلِكُمُ اللّٰهُ رَبُّكُمْ لَهُ الْمُلْكُ ۜ وَالَّذِينَ تَدْعُونَ مِنْ
دُونِهِ مَا يَمْلِكُونَ مِنْ قِطْمِيرٍ ۜ ﴿١٣﴾ اِنْ تَدْعُوهُمْ لَا يَسْمَعُوا دُعَآءَكُمْ ۚ وَلَوْ سَمِعُوا مَا اسْتَجَابُوا لَكُمْ
ۜ وَيَوْمَ الْقِيٰمَةِ يَكْفُرُونَ بِشِرْكِكُمْ ۜ وَلَا يُنَبِّئُكَ مِثْلُ خَبِيرٍ ۚ ﴿١٤﴾ يَٓا اَيُّهَا النَّاسُ اَنْتُمُ الْفُقَرَآءُ اِلَى
اللّٰهِ ۚ وَاللّٰهُ هُوَ الْغَنِيُّ الْحَمِيدُ ﴿١٥﴾ اِنْ يَشَاْ يُذْهِبْكُمْ وَيَاْتِ بِخَلْقٍ جَدِيدٍ ۚ﴿١٦﴾ وَمَا ذٰلِكَ عَلَى اللّٰهِ
بِعَزِيزٍ ﴿١٧﴾

---

**gecəyə qatıb gündüzü qısa, gecəni uzun edər.** (Gecə və gündüzün gah uzun, gah qısa olması Allah-Təalanın tövhid və qüdrətinə böyük dəlildir). (وَسَخَّرَ الشَّمْسَ وَالْقَمَرَ ۘ كُلٌّ يَجْرِي لِاَجَلٍ مُسَمًّى ۜ) **- Allah-Təala öz üstün qüdrəti ilə günəşi, ayı özünə tabe edib, müəyyən edilmiş vaxta** (qiyamətə) **kimi onun hökm və iradəsiylə bir qayda üzrə dövran edib, Allah-Təalanın hökm və iradəsindən çıxa bilməzlər.** (ذٰلِكُمُ اللّٰهُ رَبُّكُمْ لَهُ الْمُلْكُ) **- Bu bəhs olunan sifətlərin sahibi sizin rəbbiniz Allah-Təaladır. Bütün varlıq onun mülkü və idarəsi altındadır. Necə idarə etsə, heç bir nəfər ona mane ola bilməz.** (وَالَّذِينَ تَدْعُونَ مِنْ دُونِهِ مَا يَمْلِكُونَ مِنْ قِطْمِيرٍ ۜ) **- Amma Allah-Təaladan başqa dua edib, dəvət etdiyiniz o bütlər xurma toxumunun üstündə olan nazik pərdə qədər bir şeyə də malik deyillər. Ağıllı adam da belə şeylərə ibadət edərmi?**

**14)** (اِنْ تَدْعُوهُمْ لَا يَسْمَعُوا دُعَآءَكُمْ) **- Əgər o bütlərə ehtiyacınız olanda dua etsəniz, cansız olduqlarına görə, sizin duanızı eşitməzlər.** (وَلَوْ سَمِعُوا مَا اسْتَجَابُوا لَكُمْ) **- Əgər o bütlər sizin duanızı eşitsələr də, qüdrətləri yoxdur ki, sizin dualarınızı qəbul edib ehtiyaclarınızı həll edələr. Siz onları məbud sayıb, onların tanrılığını iddia edirsiniz. Amma onlar özləri tanrılıqdan çəkinirlər.** (وَيَوْمَ الْقِيٰمَةِ يَكْفُرُونَ بِشِرْكِكُمْ) **- Həmin bütlər qiyamət günündə sizin onları Allah-Təalaya şərik saymanızı rədd edib, onlara isnad edilən tanrılıq sifətlərindən üz çevirərlər.** (وَلَا يُنَبِّئُكَ مِثْلُ خَبِيرٍ ۚ) **-** (Ey Məhəmməd), **müşriklərin xəbərlərindən mənim kimi xəbərdar olan bir şəxs tapılmaz ki, sənə xəbər versin. Onların əməllərinin həqiqətindən yalnız mən agaham.**

**15)** (يَٓا اَيُّهَا النَّاسُ اَنْتُمُ الْفُقَرَآءُ اِلَى اللّٰهِ ۚ وَاللّٰهُ هُوَ الْغَنِيُّ الْحَمِيدُ) **- Ey insan nəsli, sizin hamınız tamamilə Allah-Təalanın lütf və ehsanına möhtacsınız. Sizdən ötrü həmişə bu ehtiyac vardır. Ehtiyacsız olub, məxluquna mərhəmət edib verdiyi nemətlərinə görə həmd-sənaya layiq olan varlıq ancaq Allah-Təaladır. Gərək ona həmd olunsun.**

**16-17)** (اِنْ يَشَاْ يُذْهِبْكُمْ وَيَاْتِ بِخَلْقٍ جَدِيدٍ ۚ) **- Əgər Allah-Təala istəsə, şirk qoşduğunuza görə sizin hamınızı həlak edib, sizdən sonra yeni məxluqlar yaradıb, dünyaya gətirər.** (وَمَا ذٰلِكَ عَلَى اللّٰهِ بِعَزِيزٍ) **- Sizi həlak edib, əlahiddə məxluqlar yaratmaq Allah-Təala üçün imkansız olan bir iş deyildir. Allah-Təala qadir varlıqdır. Qüdrəti hər bir şeyi ehtiva edər.**

وَلَا تَزِرُ وَازِرَةٌ وِزْرَ اُخْرٰى ۜ وَاِنْ تَدْعُ مُثْقَلَةٌ اِلٰى حِمْلِهَا لَا يُحْمَلْ مِنْهُ شَيْءٌ وَلَوْ كَانَ ذَا قُرْبٰى ۜ اِنَّمَا تُنْذِرُ الَّذِينَ يَخْشَوْنَ رَبَّهُمْ بِالْغَيْبِ وَاَقَامُوا الصَّلٰوةَ وَمَنْ تَزَكّٰى فَاِنَّمَا يَتَزَكّٰى لِنَفْسِهٖ ۜ وَاِلَى اللّٰهِ الْمَصِيرُ ﴿١٨﴾ وَمَا يَسْتَوِي الْاَعْمٰى وَالْبَصِيرُ ۙ

---

**18)** (وَلَا تَزِرُ وَازِرَةٌ وِزْرَ اُخْرٰى ۜ) **- Allah-Təalanın qanununda heç bir nəfs günahkarın günahını yüklənib, onun əvəzinə o nəfsdən* sorğu-sual olunub töhmətlənməz. Yəni zalım və günahkarın əvəzinə bir özgə şəxs qınanmaz.** (Bu hikmət islam ümmətində gərək əbədi qanun olsun, lakin zalımlar şəxsin əvəzinə qardaşını, bəlkə qonşusunu sorğu-suala çəkərlər. Allah-Təala bu zülm hərəkəti qadağan edir).

*(*Qeyd: "Bu xəbis sifət islam ümməti üçün digər hökmlər kimi haqsız olaraq qanuna çevrilibdir. Qardaşı qardaş əvəzinə, ya atanı oğul əvəzinə, ya qonşunu qonşu əvəzinə tutub, cərimə edib, qisas almaq onların arasında ilahi hökm hesab olunur. Belə əməlləri ilə yenə deyirlər ki, biz Quran əhliyik və Quranın hökmlərinə əməl edirik. Hər səhər Quranı əllərinə alıb, guya, ona hörmət edirlər. Həmin ayəni və onun kimi ayələri oxusalar da, mənasına əsla diqqət etməyib, özlərini Allah-Təalaya yaxın sayırlar. Qurani-Şərif əməl etmək üçün göndərilib, nəinki boş-boş qiraət etməkdən ötrü, necə ki Allahın Rəsulu buyurubdur: "Vay olsun o şəxsə ki, Qurani-Şərifin ayəsini oxuyub, amma təfəkkür etməyə, Quranın itaət edilməsi vacib olan ehkamına arxa çevirib, onu tərk etmək islam ümmətini günbəgün geriyə salıb, cəhalətə, zəlalətə və məhv olmağa düçar edib. İslam ümməti, gərək, gözlərini açıb, Qurani-Şərifin açıq-aydın ayələrinə fikir verib, özlərini cəhalət və zəlalətdən xilas etsinlər).*

(وَاِنْ تَدْعُ مُثْقَلَةٌ اِلٰى حِمْلِهَا لَا يُحْمَلْ مِنْهُ شَيْءٌ وَلَوْ كَانَ ذَا قُرْبٰى ۜ) **- Qiyamət günündə günah səbəbinə yükü ağır olan bir nəfs əgər bir özgə nəfsi çağırsa ki, onun günahından bir qədər yüklənib, öz yükü azalsın, heç bir şey onun günahından götürülməz. Hətta o dəvət olunan yaxın qohum da olsa,** (ata, ana, bacı, qardaş kimi), **heç bir nəfərdən ogünkü gündə kömək olmaz. Yardım etmək Allah-Təalaya məxsusdur.**

(اِنَّمَا تُنْذِرُ الَّذِينَ يَخْشَوْنَ رَبَّهُمْ بِالْغَيْبِ وَاَقَامُوا الصَّلٰوةَ) - (Ey Məhəmməd), **qiyamət gününün əzabından qorxutmaq müşriklərə fayda verməyib, onlara təsir etməz. Həqiqətən, sənin qorxutmağın o şəxslərə xeyir verir ki, rəbləri Allah-Təalanın əzabını görməmiş ondan qorxub, namaz qılalar, belə şəxslərə sənin qorxutmağın fayda verib, Allah-Təalanın itaətində sabit və bərqərar olarlar.** (وَمَنْ تَزَكّٰى فَاِنَّمَا يَتَزَكّٰى لِنَفْسِهٖ) **- Kim günahı tərk edib Allah-Təalanın ehkamına əməl etməklə nəfsini günahın xəbisliyindən pak etsə, həqiqətən, o şəxs öz nəfsindən ötrü paklıq edib, o paklığın faydası onun öz nəfsinə aid olacaqdır.** (وَاِلَى اللّٰهِ الْمَصِيرُ) **- Hamının qayıdacağı yer Allah-Təalanın tərəfinədir. Hər bir şəxsin öz əməlinin qarşılığını ona yetirəcəkdir.**

﴿١٩﴾ وَلَا الظُّلُمَاتُ وَلَا النُّورُ ﴿٢٠﴾ وَلَا الظِّلُّ وَلَا الْحَرُورُ ﴿٢١﴾ وَمَا يَسْتَوِي الْاَحْيَآءُ وَلَا
الْاَمْوَاتُ اِنَّ اللّٰهَ يُسْمِعُ مَنْ يَشَآءُ وَمَآ اَنْتَ بِمُسْمِعٍ مَنْ فِي الْقُبُورِ ﴿٢٢﴾ اِنْ اَنْتَ اِلَّا نَذِيرٌ ﴿٢٣﴾
اِنَّآ اَرْسَلْنَاكَ بِالْحَقِّ بَشِيرًا وَنَذِيرًا وَاِنْ مِنْ اُمَّةٍ اِلَّا خَلَا فِيهَا نَذِيرٌ ﴿٢٤﴾ وَاِنْ يُكَذِّبُوكَ فَقَدْ كَذَّبَ
الَّذِينَ مِنْ قَبْلِهِمْ جَآءَتْهُمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ وَبِالزُّبُرِ وَبِالْكِتَابِ الْمُنِيرِ ﴿٢٥﴾ ثُمَّ اَخَذْتُ الَّذِينَ كَفَرُوا
فَكَيْفَ كَانَ نَكِيرِ ﴿٢٦﴾

---

**19-23) (وَمَا يَسْتَوِي الْاَعْمٰى وَالْبَصِيرُ) - Heç vaxt korla görən** (möminlə kafir, alimlə cahil) **bərabər olmaz. (وَلَا الظُّلُمَاتُ وَلَا النُّورُ وَلَا الظِّلُّ وَلَا الْحَرُورُ) - Və qaranlıqlarla işıqlıq və soyuğun sərinliyi ilə günəşin hərarəti** (haqla batil) **bərabər ola bilməz. (وَمَا يَسْتَوِي الْاَحْيَآءُ وَلَا الْاَمْوَاتُ) - Dirilərlə ölülər də** (islam dininə daxil olanla, olmayanlar) **bərabər deyildir. (اِنَّ اللّٰهَ يُسْمِعُ مَنْ يَشَآءُ وَمَآ اَنْتَ بِمُسْمِعٍ مَنْ فِي الْقُبُورِ) -** (Ey Məhəmməd), **islama daxil olub, olmayanlardan Allah-Təala agahdır. Hidayətə qabil olan şəxsi Allah-Təala hidayətə çatdırıb, sənin sözünü ona eşitdirər. Amma onların işi sənə gizli qaldığı üçün onların islama daxil olmağı üçün istəyirsən, özünü həlak edəsən. Yox, qəbirlərdəki ölülər kimi, müşriklərə də haqq sözü eşitdirib onları imana daxil etməyə sən qadir deyilsən. (اِنْ اَنْتَ اِلَّا نَذِيرٌ) -** (Ey Məhəmməd), **sən ancaq xalqı bizim əzabımızla qorxudansan. Daha onların imana daxil olub, olmamalarının sənə heç bir dəxli yoxdur. Onları mənə həvalə et.**

**24) (اِنَّآ اَرْسَلْنَاكَ بِالْحَقِّ بَشِيرًا وَنَذِيرًا وَاِنْ مِنْ اُمَّةٍ اِلَّا خَلَا فِيهَا نَذِيرٌ) -** (Ey Məhəmməd), **həqiqətən, biz səni haqq və ədalətlə rəhmətimizlə müjdələyib, əzabımızla qorxudan göndərmişik. Heç bir ümmət səndən əvvəl keçməyibdir ki, Allah-Təala öz hikməti və məsləhəti ilə hər bir əsrdə o ümmətlərə peyğəmbər göndərməsin, sən də onlar kimi bir peyğəmbərsən, nədən ötrü bu Qüreyş camaatı sənin peyğəmbərliyinə təəccüb edib, inkar edirlər, indi ki onlar səni təkzib edib inkar edirlər, gərək sən də səbir edib, onların işlərini mənə həvalə edəsən.**

**25) (وَاِنْ يُكَذِّبُوكَ فَقَدْ كَذَّبَ الَّذِينَ مِنْ قَبْلِهِمْ) -** (Ey Məhəmməd), **əgər bu Qüreyş camaatı səni təkzib edirsə, həqiqətən, onlardan əvvəl yaşayan camaatlar da öz peyğəmbərlərini təkzib ediblər.**

**(جَآءَتْهُمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ وَبِالزُّبُرِ وَبِالْكِتَابِ الْمُنِيرِ) -Və halbuki peyğəmbərlər onlara özlərinin doğruluğuna sübut olan açıq-aşkar dəlillər və ilahi ehkamı ehtiva edən səhifələr** (kiçik kitablar) **və nurani böyük kitablarla** (Tövrat, İncil kimi) **gəlib onları dəvət ediblər, bununla belə yenə onlara iman etmədilər.** (Ey Məhəmməd), **sən də onlara baxıb, təsəlli tapıb, seyr et.**

**26) (ثُمَّ اَخَذْتُ الَّذِينَ كَفَرُوا فَكَيْفَ كَانَ نَكِيرِ) - İman etməyib, küfrlərində sabit**

اَلَمْ تَرَ اَنَّ اللّٰهَ اَنْزَلَ مِنَ السَّمَٓاءِ مَٓاءًۚ فَاَخْرَجْنَا بِه۪ ثَمَرَاتٍ مُخْتَلِفًا اَلْوَانُهَاۜ وَمِنَ الْجِبَالِ جُدَدٌ ب۪يضٌ
وَحُمْرٌ مُخْتَلِفٌ اَلْوَانُهَا وَغَرَاب۪يبُ سُودٌ ﴿٢٧﴾ وَمِنَ النَّاسِ وَالدَّوَٓابِّ وَالْاَنْعَامِ مُخْتَلِفٌ اَلْوَانُهُ
كَذٰلِكَۜ اِنَّمَا يَخْشَى اللّٰهَ مِنْ عِبَادِهِ الْعُلَمٰٓؤُاۜ اِنَّ اللّٰهَ عَز۪يزٌ غَفُورٌ ﴿٢٨﴾ اِنَّ الَّذ۪ينَ يَتْلُونَ كِتَابَ اللّٰهِ
وَاَقَامُوا الصَّلٰوةَ وَاَنْفَقُوا مِمَّا رَزَقْنَاهُمْ سِرًّا وَعَلَانِيَةً يَرْجُونَ تِجَارَةً لَنْ تَبُورَۙ ﴿٢٩﴾ لِيُوَفِّيَهُمْ اُجُورَهُمْ
وَيَز۪يدَهُمْ مِنْ فَضْلِه۪ۜ

---

**olandan sonra o kafirləri əzab və əziyyətə salıb, hamısını həlak etdim.** (Ey Məhəmməd), **bax gör ki, mənim onlara əzab etməyim necə oldu. Habelə bu müşriklərə də əzab göndərib səni onlara qalib edəcəyəm,** (Bədir savaşında Allah-Təala müşrikləri zəlil və məhv edib, öz peyğəmbərini onlara qalib etdi).

**27) (اَلَمْ تَرَ اَنَّ اللّٰهَ اَنْزَلَ مِنَ السَّمَٓاءِ مَٓاءًۚ فَاَخْرَجْنَا بِه۪ ثَمَرَاتٍ مُخْتَلِفًا اَلْوَانُهَاۜ) - Bəs baxıb görmürsən ki,** (ey Məhəmməd), **mən sənin rəbbin Allah-Təalayam. Göydən su endirib, onun səbəbinə yerdən rəngləri və cinsləri müxtəlif olan meyvələr çıxarıb sizdən ötrü ruzi edirik. (وَمِنَ الْجِبَالِ جُدَدٌ ب۪يضٌ وَحُمْرٌ مُخْتَلِفٌ اَلْوَانُهَا) - Allah-Təala sizdən ötrü dağları yaradıb, o dağlardan bəzi yollar salıb, o dağların arasından gedib gələnlərdən ötrü yollar düzəldibdir. O dağların rəngləri müxtəlif, bəzisi ağ, bəzisi qırmızıdır.** (Allah-Təala dağlara verdiyi xüsusiyyətlərə görə, onların rənglərini müxtəlif edibdir). **(وَغَرَاب۪يبُ سُود) - Bəzi dağların rəngi son dərəcə qaradır.**

**28)(وَمِنَ النَّاسِ وَالدَّوَٓابِّ وَالْاَنْعَامِ مُخْتَلِفٌ اَلْوَانُهُ كَذٰلِكَ) - İnsanların və yer üzündə hərəkət edən heyvanların-xüsusən, dəvə, öküz, qoyun, keçi kimi, meyvələr və dağlar kimi müxtəlif rəngli olanları vardır. Allah-Təala hər birini bir rəngdə və bir surətdə yaradıbdır. Bunlar hamısı Allah-Təalanın kamil qüdrətinə işarə deyilmi? ( اِنَّمَا يَخْشَى اللّٰهَ مِنْ عِبَادِهِ الْعُلَمٰٓؤُاۜ)** - (Ey Məhəmməd), **bu dəlil və sübutlar ki, Allah-Təalanın tövhid və qüdrətinə aid bəhs etdik, həqiqətən, onları o alim şəxslər dərk edib Allah-Təaladan qorxar ki, onun ədalət və tövhid sifətinə agah olub, əzəmət və qüdrətindən xəbərdardırlar. (اِنَّ اللّٰهَ عَز۪يزٌ غَفُورٌ) - Həqiqətən, Allah-Təala məxluqata qalib olub, tövbə edənləri bağışlayandır.**

**29) (اِنَّ الَّذ۪ينَ يَتْلُونَ كِتَابَ اللّٰهِ)** - (Ey Məhəmməd), **o şəxslər ki Qurani-Şərifin ayələrini oxuyub, təfəkkür edib, onun ehkamına əməl etsinlər, (وَاَقَامُوا الصَّلٰوةَ وَاَنْفَقُوا مِمَّا رَزَقْنَاهُمْ سِرًّا وَعَلَانِيَةً) - namaz qılıb, onlara verdiyimiz ruzilərdən bizim yolumuzda gizlincə və aşkarda xərcləyib, ehsan verələr, (يَرْجُونَ تِجَارَةً لَنْ تَبُورَ) - belə şəxslər əsla pozulmayan və qazancsız olmayan ticarətə ümidvar olarlar.**

**30) (لِيُوَفِّيَهُمْ اُجُورَهُمْ وَيَز۪يدَهُمْ مِنْ فَضْلِه۪ۜ) - Onların ticarətləri batil olmaz, belə ki, qiyamət günündə Allah-Təala onların əməllərinin savabını ve-**

إِنَّهُ غَفُورٌ شَكُورٌ ﴿٣٠﴾ وَالَّذِيٓ اَوْحَيْنَآ اِلَيْكَ مِنَ الْكِتَابِ هُوَ الْحَقُّ مُصَدِّقًا لِمَا بَيْنَ يَدَيْهِ ۗ اِنَّ اللّٰهَ
بِعِبَادِهٖ لَخَبِيرٌ بَصِيرٌ ﴿٣١﴾ ثُمَّ اَوْرَثْنَا الْكِتَابَ الَّذِينَ اصْطَفَيْنَا مِنْ عِبَادِنَاۚ فَمِنْهُمْ ظَالِمٌ لِنَفْسِهٖۚ وَمِنْهُمْ
مُقْتَصِدٌۚ وَمِنْهُمْ سَابِقٌ بِالْخَيْرَاتِ بِاِذْنِ اللّٰهِۜ ذٰلِكَ هُوَ الْفَضْلُ الْكَبِيرُۜ ﴿٣٢﴾ جَنَّاتُ عَدْنٍ يَدْخُلُونَهَا
يُحَلَّوْنَ فِيهَا مِنْ اَسَاوِرَ مِنْ ذَهَبٍ وَلُؤْلُؤًاۚ وَلِبَاسُهُمْ فِيهَا حَرِيرٌ ﴿٣٣﴾ وَقَالُوا الْحَمْدُ لِلّٰهِ الَّذِيٓ اَذْهَبَ
عَنَّا الْحَزَنَۜ اِنَّ رَبَّنَا لَغَفُورٌ شَكُورٌۙ ﴿٣٤﴾

---

**rib, mükafatlarından əlavə öz lütf və rəhmətindən onlardan ötrü artırar. (إِنَّهُ غَفُورٌ شَكُورٌ) - Həqiqətən, Allah-Təala onları bağışlayıb əməllərinin qarşılığını artıqlaması ilə onlara verəndir.**

**31) (وَالَّذِيٓ اَوْحَيْنَآ اِلَيْكَ مِنَ الْكِتَابِ هُوَ الْحَقُّ مُصَدِّقًا لِمَا بَيْنَ يَدَيْهِ)** - (Ey Məhəmməd), **o Quran ki, sənə vəhy edirik, özündən əvvəl göndərilən kitabları** (Tövrat və İncili) **təsdiq edən, rəbbin Allah-Təalanın haqq olan kitabıdır. (اِنَّ اللّٰهَ بِعِبَادِهٖ لَخَبِيرٌ بَصِيرٌ) Həqiqətən, Allah-Təala bəndələrinin əhvalından agah olub, hər bir əməllərini görəndir.** (Ey Məhəmməd), **sənin əhvalına da xəbərdar olub, sənə belə bir kitab** (Quran) **göndərib, səndən ötrü möcüzə yaratmağa səni layiq görübdür.**

**32) (ثُمَّ اَوْرَثْنَا الْكِتَابَ الَّذِينَ اصْطَفَيْنَا مِنْ عِبَادِنَاۚ) -** (Ey Məhəmməd), **bu Quranı sənə vəhy edib göndərəndən sonra bəndələrimiz arasından seçdiyimiz sənin ümmətinə onu miras verdik. Ta ki, onun ehkamına əməl etsinlər. (فَمِنْهُمْ ظَالِمٌ لِنَفْسِهٖۚ)** - (Ey Məhəmməd), **sənin ümmətindən Qurana varis olan bəziləri Quranın ehkamına əməl etməyib, öz nəfslərinə qarşı zalım olarlar.** (Bunlar dünyadan tövbəsiz getsələr, həmişə əzabda olacaqdırlar). (və minhum muqtəsid) **Onlardan bəziləri də günahla savabı bir-birinə qarışdırıb, günahla-savab arasında olarlar.** (Bunların əgər savabları günahlarından artıq olsa, nicat taparlar. Amma əgər günahları savablarından çox olsa, əzaba düçar olacaqlar). **(وَمِنْهُمْ مُقْتَصِدٌۚ وَمِنْهُمْ سَابِقٌ بِالْخَيْرَاتِ بِاِذْنِ اللّٰهِ) Onlardan bəzisi Allah-Təalanın yardımı ilə hər bir xeyir işdə irəliləyərlər.** (Bunlar axirət günündə nicat taparlar). **(ذٰلِكَ هُوَ الْفَضْلُ الْكَبِيرُ) Hər bir xeyir işdə irəliləmək böyük fəzilətdir.**

**33) (جَنَّاتُ عَدْنٍ يَدْخُلُونَهَا) - Hər bir xeyir işdə irəliləmək səbəbinə onlar həmişəlik cənnətlərə daxil olarlar. (يُحَلَّوْنَ فِيهَا مِنْ اَسَاوِرَ مِنْ ذَهَبٍ وَلُؤْلُؤًاۚ) O cənnətlərdə onlara qızıldan qolbaqlar və mirvari ilə zinət verərlər. (وَلِبَاسُهُمْ فِيهَا حَرِيرٌ) O cənnətlərdə libasları ipəkdən olar,** (dünyada ipək libas islam ümmətinə haram olduğu üçün Allah-Təala möminlərə axirətdə ipək libas vəd edir).

**34) (وَقَالُوا الْحَمْدُ لِلّٰهِ الَّذِيٓ اَذْهَبَ عَنَّا الْحَزَنَۜ اِنَّ رَبَّنَا لَغَفُورٌ شَكُورٌ) - Möminlər cənnətlərdə Allah-Təalaya həmd-səna edib belə deyərlər: "Həmd olsun o Allah-**

اَلَّذِيٓ اَحَلَّنَا دَارَ الْمُقَامَةِ مِنْ فَضْلِهٖۚ لَا يَمَسُّنَا فِيهَا نَصَبٌ وَلَا يَمَسُّنَا فِيهَا لُغُوبٌ ﴿٣٥﴾ وَالَّذِينَ كَفَرُوا لَهُمْ نَارُ جَهَنَّمَۚ لَا يُقْضٰى عَلَيْهِمْ فَيَمُوتُوا وَلَا يُخَفَّفُ عَنْهُمْ مِنْ عَذَابِهَاۜ كَذٰلِكَ نَجْزِي كُلَّ كَفُورٍۚ ﴿٣٦﴾ وَهُمْ يَصْطَرِخُونَ فِيهَاۚ رَبَّنَآ اَخْرِجْنَا نَعْمَلْ صَالِحًا غَيْرَ الَّذِي كُنَّا نَعْمَلُۜ اَوَلَمْ نُعَمِّرْكُمْ مَا يَتَذَكَّرُ فِيهِ مَنْ تَذَكَّرَ وَجَآءَكُمُ النَّذِيرُۜ فَذُوقُوا فَمَا لِلظَّالِمِينَ مِنْ نَصِيرٍۚ ﴿٣٧﴾ اِنَّ اللّٰهَ عَالِمُ غَيْبِ السَّمٰوَاتِ وَالْاَرْضِۜ اِنَّهُ عَلِيمٌ بِذَاتِ الصُّدُورِ ﴿٣٨﴾

---

**Təalaya ki, bizdən hər bir qəm və qüssəni götürüb, bizə əzabdan nicat verdi. Həqiqətən, bizim rəbbimiz Allah-Təala çox bağışlayan və hər bir xeyir əməli çox artırandır”.**

**35) (اَلَّذِيٓ اَحَلَّنَا دَارَ الْمُقَامَةِ مِنْ فَضْلِهٖۚ)** - (Möminlər deyir:) **“Bizim rəbbimiz o Allah-Təaladır ki, öz lütf və rəhməti səbəbi ilə bizi həmişəlik evinə** (Cənnətə) **daxil etdi. (0لَا يَمَسُّنَا فِيهَا نَصَبٌ وَلَا يَمَسُّنَا فِيهَا ل ) - O cənnətdə bizlərə nə zəhmət, nə məşəqqət və nə də məşəqqətdən hasil olan zəiflik və süstlük gəlməyib, bəlkə hər bir zəhmətdən azad, cənnətlərdə rahat və asudəyik”.**

**36) (وَالَّذِينَ كَفَرُوا لَهُمْ نَارُ جَهَنَّمَۚ لَا يُقْضٰى عَلَيْهِمْ فَيَمُوتُوا وَلَا يُخَفَّفُ عَنْهُمْ مِنْ عَذَابِهَاۜ) - O şəxslər ki, Allah-Təalaya və Qurana kafir oldular, onlardan ötrü cəhənnəm odunun əzabı vardır. Allah-Təala tərəfindən onlara cəhənnəmdə nə ölüm hökmü verilməz ki, ölüm onlara gəlib, əzabdan xilas olsunlar, nə də cəhənnəmin əzabı onlardan yüngülləşdirilməz ki, əzabları bir qədər az olsun. (كَذٰلِكَ نَجْزِي كُلَّ كَفُورٍۚ)** - (Ey Məhəmməd), **hər bir kafirə belə cəza verərik.**

**37) (وَهُمْ يَصْطَرِخُونَ فِيهَاۚ رَبَّنَآ اَخْرِجْنَا نَعْمَلْ صَالِحًا غَيْرَ الَّذِي كُنَّا نَعْمَلُ) - Cəhənnəmdə olanlar şiddətlə nalə edib, Allah-Təalaya dua edib deyərlər: “Ey bizim rəbbimiz, bizi bu cəhənnəmdən çıxarıb, dünyaya qaytar ki, dünyada etdiyimiz pis əməllərdən başqa xeyirli işlər də görək. (اَوَلَمْ نُعَمِّرْكُمْ مَا يَتَذَكَّرُ فِيهِ مَنْ تَذَكَّرُ)** - (Allah-Təala buyurur:) **Onların cavabında rəbbin deyər: “Bəs mən sizə dünyada o qədər ömür vermədimmi ki, hər bir şəxs ömrü boyu nə qədər istəsə, o qədər Allah-Təalanı zikr edib, tanıyıb, yaman əməlləri tərk edib, hər bir işini islah edə idi? Əlbəttə sizə mən o qədər ömür verdim, amma siz nəfsin istəklərinə tabe olub, mənə asi oldunuz. (وَجَآءَكُمُ النَّذِير) - Sizə bizim tərəfimizdən peyğəmbər gəlib, bizim əzabımızla sizi qorxutdu. Siz peyğəmbəri təkzib edib, mənə asi oldunuz. Əgər sizi yenidən qaytarsam, yenə mənə asi olacaqsınız. (فَذُوقُوا فَمَا لِلظَّالِمِينَ مِنْ نَصِيرٍۚ) - Bu cəhənnəm əzabını dadın, sizin kimi zalımlardan ötrü heç bir kömək edən və əzabdan nicat verən tapılmaz.**

**38) (اِنَّ اللّٰهَ عَالِمُ غَيْبِ السَّمٰوَاتِ وَالْاَرْضِۜ اِنَّهُ عَلِيمٌ بِذَاتِ الصُّدُورِ) - Həqiqətən, asimanların və yerin hər bir qeyb işlərinə agah olan Allah-Təaladır. Həqiqətən, sinələrdə olan hər bir sirdən də Allah-Təala agahdır.** (Hər bir gizli şeylərə

هُوَ الَّذِي جَعَلَكُمْ خَلَآئِفَ فِي الْاَرْضِ فَمَنْ كَفَرَ فَعَلَيْهِ كُفْرُهُ وَلَا يَزِيدُ الْكَافِرِينَ كُفْرُهُمْ عِنْدَ رَبِّهِمْ اِلَّا مَقْتًا وَلَا يَزِيدُ الْكَافِرِينَ كُفْرُهُمْ اِلَّا خَسَارًا ﴿٣٩﴾ قُلْ اَرَاَيْتُمْ شُرَكَآءَكُمُ الَّذِينَ تَدْعُونَ مِنْ دُونِ اللّٰهِ اَرُونِي مَاذَا خَلَقُوا مِنَ الْاَرْضِ اَمْ لَهُمْ شِرْكٌ فِي السَّمٰوَاتِ اَمْ اٰتَيْنَاهُمْ كِتَابًا فَهُمْ عَلٰى بَيِّنَتٍ مِنْهُ بَلْ اِنْ يَعِدُ الظَّالِمُونَ بَعْضُهُمْ بَعْضًا اِلَّا غُرُورًا ﴿٤٠﴾ اِنَّ اللّٰهَ يُمْسِكُ السَّمٰوَاتِ وَالْاَرْضَ اَنْ تَزُولَا وَلَئِنْ زَالَتَآ اِنْ اَمْسَكَهُمَا مِنْ اَحَدٍ مِنْ بَعْدِهِ

---

agah olan Allah-Təala buna da agahdır ki, əgər sizi dünyaya qaytarsa, yenə asi olacaqsınız).

**39) (هُوَ الَّذِي جَعَلَكُمْ خَلَآئِفَ فِي الْاَرْضِ) - Allah-Təala sizi özünün yer üzündəki canişini seçib yerin hər bir işinə sizi sahib etdi. Siz də yerdə istədiyiniz işi edirsiniz. (فَمَنْ كَفَرَ فَعَلَيْهِ كُفْرُهُ) - Sizdən kim Allah-Təalaya kafir olsa, onun kafir olmağının günahının əzabı özünə aid olar.**

**(وَلَا يَزِيدُ الْكَافِرِينَ كُفْرُهُمْ عِنْدَ رَبِّهِمْ اِلَّا مَقْتًا) - Kafirlərin küfrü öz rəbləri Allah-Təala yanında onlardan ötrü şiddətli düşmənçilik və ədavətdən başqa bir şey artırmaz, Allah-Təala da onlara son dərəcə düşmən olar.**

**(وَلَا يَزِيدُ الْكَافِرِينَ كُفْرُهُمْ اِلَّا خَسَارًا) -Və axirətdə kafirlərin zülmü onlardan ötrü zərər və ziyandan başqa, bir şey artırmaz, zərərləri özlərinə aid olub, heç bir şəxsə zərər verə bilməzlər.**

**40) (قُلْ اَرَاَيْتُمْ شُرَكَآءَكُمُ الَّذِينَ تَدْعُونَ مِنْ دُونِ اللّٰهِ اَرُونِي مَاذَا خَلَقُوا مِنَ الْاَرْضِ)** - (Ey Məhəmməd), **müşriklərə de ki, sizin bu şərikləriniz ki, Allah-Təaladan başqa onlara dua edib, ibadət edirsiniz, mənə xəbər verin, göstərin görək, Allah-Təaladan başqa tək başlarına bu yerin bir qisminə və bir nöqtəsinə sahib olub, bir şey yaradıblarmı ki, belə bir qüdrət onlardan ötrü sabit olsun? (اَمْ لَهُمْ شِرْكٌ فِي السَّمٰوَاتِ) - Ya da ki əgər onların şərikləri yerdə bir şey yaratmayıblarsa, bəlkə deyirlər ki, göylərin yaradılmasında Allah-Təala ilə şərikdirlər? (اَمْ اٰتَيْنَاهُمْ كِتَابًا فَهُمْ عَلٰى بَيِّنَتٍ مِنْهُ) - Ya da ki bəlkə, biz o şəriklərə kitab vermişik, onların o kitaba görə bizə şərik olmaqda dəlil və sübutları var?** (Ey Məhəmməd), **müşriklərdən soruş ki, bunların hansı biri o şəriklərdən ötrü vardır? (بَلْ اِنْ يَعِدُ الظَّالِمُونَ بَعْضُهُمْ بَعْضًا اِلَّا غُرُورًا) - Bəlkə, bu zalım müşriklər-tabe olanlara rəislərinin vəd etdiyi kimi, deyirlər: “Bu bütlər bizdən ötrü qiyamət günündə şəfaət edəcəklər?” Nahaq və batil vəddir.**

**41) (اِنَّ اللّٰهَ يُمْسِكُ السَّمٰوَاتِ وَالْاَرْضَ اَنْ تَزُولَا) - Həqiqətən, Allah-Təala ancaq öz kamil qüdrəti ilə təkbaşına, köməksiz və sütunsuz olaraq göyləri və yeri düşməkdən qoruyub saxlayır, onların bütləri Allah-Təalaya kömək edən deyildir. (وَلَئِنْ زَالَتَآ اِنْ اَمْسَكَهُمَا مِنْ اَحَدٍ مِنْ بَعْدِهِ) - Əgər bir ehtimal, göylər və yer öz mərkəzlərindən ayrılıb düşsə, Allah-Təaladan başqa, heç bir**

اِنَّهُ كَانَ حَلِيمًا غَفُورًا ﴿٤١﴾ وَاَقْسَمُوا بِاللّٰهِ جَهْدَ اَيْمَانِهِمْ لَئِنْ جَٓاءَهُمْ نَذِيرٌ لَيَكُونُنَّ اَهْدٰى مِنْ
اِحْدَى الْاُمَمِۚ فَلَمَّا جَٓاءَهُمْ نَذِيرٌ مَا زَادَهُمْ اِلَّا نُفُورًاۙ ﴿٤٢﴾ اِسْتِكْبَارًا فِي الْاَرْضِ وَمَكْرَ السَّيِّئِؕ وَلَا
يَحِيقُ الْمَكْرُ السَّيِّئُ اِلَّا بِاَهْلِهِؕ فَهَلْ يَنْظُرُونَ اِلَّا سُنَّتَ الْاَوَّلِينَۚ فَلَنْ تَجِدَ لِسُنَّتِ اللّٰهِ تَبْدِيلًاۚ

---

**nəfər onları saxlaya bilməz. (اِنَّهُ كَانَ حَلِيمًا غَفُورًا) - Həqiqətən, Allah-Təala əzab etməkdə tələsən deyildir və tövbə edənlərin günahlarını çox bağışlayandı, halbuki müşriklərin küfr sözləri səbəbi ilə, gərək, göylər, yer parçalanıb və məhv olub, onları da həlak edəydi.** (Allahın Rəsulu Məkkədə peyğəmbərliklə vəzifələndirilmədən əvvəl Məkkə əhli yəhudi camaatına tənə edib deyirdilər: “Yəhudilər peyğəmbərləri təkzib ediblər, əgər bizə bir peyğəmbər gəlsə, yəhudi, xristian ümmətlərindən daha artıq hidayətdə olub peyğəmbərə tabe olarıq”. Elə ki Məhəmməd ibn Abdullah (s.a.v.) Məkkədə peyğəmbərliklə vəzifələndirildi, yəhudi və xristianlardan daha çox onu təkzib etdilər. O vaxt bu ayə gəldi).

**42) (وَاَقْسَمُوا بِاللّٰهِ جَهْدَ اَيْمَانِهِمْ لَئِنْ جَٓاءَهُمْ نَذِيرٌ لَيَكُونُنَّ اَهْدٰى مِنْ اِحْدَى الْاُمَمِۚ) -** (Ey Məhəmməd), **bu Məkkə əhli sən onlara göndərilmədən əvvəl Allah-Təalaya möhkəm and içib deyərdilər: “Əgər onlara bir peyğəmbər gəlsə, əlbəttə, yəhudi və xristian ümmətlərinin hər birindən daha artıq hidayətdə olub peyğəmbərə tabe olarlar”. (فَلَمَّا جَٓاءَهُمْ نَذِيرٌ مَا زَادَهُمْ اِلَّا نُفُورًاۙ) -** (Ey Məhəmməd), **o zaman ki onlara** (sənin kimi) **peyğəmbər gəldi, sənin onlara peyğəmbər gəlməyin onları haqdan daha da kənar edib üz döndərmələrini artırdı. Küfrlərində qalıb səni təkzib etdilər.**

**43) (اِسْتِكْبَارًا فِي الْاَرْضِ وَمَكْرَ السَّيِّئِؕ) -** (Ey Məhəmməd), **yer üzündə təkəbbürlənib, səni qətl etməkdən ötrü məkr, hiylə işlədib, haqdan nifrət edib, iman etmədilər.**

**(وَلَا يَحِيقُ الْمَكْرُ السَّيِّئُ اِلَّا بِاَهْلِهِؕ) - Yaman və xəbis, məkr və hiylə öz sahibindən başqasına yetişməz.** (Müşriklər Allahın Rəsulunu qətl etmək üçün məkr, hiylə edirdilər, məkr, hiylələri özlərinə qayıdıb Bədir günündə öldürülüb, bəzisi də əsir oldular). **(فَهَلْ يَنْظُرُونَ اِلَّا سُنَّتَ الْاَوَّلِينَۚ) -** (Ey Məhəmməd), **bu Qüreyş camaatı, bəlkə, özlərindən əvvəlki ümmətlərin aqibətini gözləyir?** (Necə ki, onlar peyğəmbərlərini təkzib edib əzaba düçar oldular, habelə bunlar da səni təkzib etmək səbəbi ilə guya əzabı gözləyirlər).

**(فَلَنْ تَجِدَ لِسُنَّتِ اللّٰهِ تَبْدِيلًاۚ) -** (Ey Məhəmməd), **peyğəmbərləri təkzib edən ümmətlərdən intiqam almaq Allah-Təalanın adətidir. Bu adətdə heç bir dəyişiklik tapa bilməzsən və heç vaxt Allah-Təalanın bu adəti dəyişməyib, peyğəmbərini təkzib edən xalqı həmişə zəlil edəcəkdir.** (Allah-Təalanın bu sözləri doğru olub peyğəmbərini təkzib edən camaatı zəlil edib, onu hamısına qalib etdi).

وَلَنْ تَجِدَ لِسُنَّتِ اللّٰهِ تَحْوِيلًا ﴿٤٣﴾ اَوَلَمْ يَسِيرُوا فِي الْاَرْضِ فَيَنْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الَّذِينَ مِنْ
قَبْلِهِمْ وَكَانُوٓا اَشَدَّ مِنْهُمْ قُوَّةًۜ وَمَا كَانَ اللّٰهُ لِيُعْجِزَهُ مِنْ شَيْءٍ فِي السَّمٰوَاتِ وَلَا فِي الْاَرْضِۜ اِنَّهُ كَانَ
عَلِيمًا قَدِيرًا ﴿٤٤﴾ وَلَوْ يُؤَاخِذُ اللّٰهُ النَّاسَ بِمَا كَسَبُوا مَا تَرَكَ عَلٰى ظَهْرِهَا مِنْ دَٓابَّةٍ وَلٰكِنْ يُؤَخِّرُهُمْ
اِلٰٓى اَجَلٍ مُسَمًّىۚ فَاِذَا جَٓاءَ اَجَلُهُمْ فَاِنَّ اللّٰهَ كَانَ بِعِبَادِهِ بَصِيرًا ﴿٤٥﴾

---

**(وَلَنْ تَجِدَ لِسُنَّتِ اللّٰهِ تَحْوِيلًا) - əlbəttə** (Ey Məhəmməd), **Allah-Təalanın adətində bir haldan digər bir hala keçmək, dəyişiklik tapmazsan.**

**44) (اَوَلَمْ يَسِيرُوا فِي الْاَرْضِ فَيَنْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الَّذِينَ مِنْ قَبْلِهِمْ) -** (Ey Məhəmməd), **bəs bu Məkkə əhli yer üzündə gəzib** (Şama və Yəmənə səfərə gedib), **baxıb görmürlər ki, onlardan əvvəl peyğəmbərləri təkzib edənlərin aqibəti necə oldu?** (Allah-Təala onlara əzab göndərib hamısını həlak etdi), **hamısını baxıb görüblər, bəs niyə ibrət almırlar? (وَكَانُوٓا اَشَدَّ مِنْهُمْ قُوَّةً) - halbuki əvvəlki ümmətlər Məkkəli Qüreyş camaatından daha güclü və şücaətli idilər.** (Allah-Təala onlardan ölmədən əvvəl intiqam aldı, bəs bu Məkkə əhli Allah-Təalanı aciz edəcək?) (وَمَا كَانَ اللّٰهُ لِيُعْجِزَهُ مِنْ شَيْءٍ فِي السَّمٰوَاتِ وَلَا فِي الْاَرْضِ) - **Əlbəttə, heç bir şey göylərdə və yerdə Allah-Təalanı aciz edə bilməyib, ondan qaça bilməyəcəklər. Bəlkə, hər bir şeyə Allah-Təala qalib olub və hər şey onun qüdrəti daxilindədir. (اِنَّهُ كَانَ عَلِيمًا قَدِيرًا) - Həqiqətən, Allah-Təala hər bir şeydən agah və qadirdir.**

**45) (وَلَوْ يُؤَاخِذُ اللّٰهُ النَّاسَ بِمَا كَسَبُوا مَا تَرَكَ عَلٰى ظَهْرِهَا مِنْ دَٓابَّةٍ) -** (Ey Məhəmməd), **əgər Allah-Təala insan nəslini etdiyi əməlləri səbəbi ilə sorğu-sual etsə, hər halda yer üzündə bir nəfər də hərəkət edən insanı sağ qoymaz. Hamısını həlak edər. (وَلٰكِنْ يُؤَخِّرُهُمْ اِلٰٓى اَجَلٍ مُسَمًّى) - Lakin Allah-Təala onların əzabını müəyyən bir vaxta (qiyamət gününə) qədər təxirə salıb. (فَاِذَا جَٓاءَ اَجَلُهُمْ فَاِنَّ اللّٰهَ كَانَ بِعِبَادِهِ بَصِيرًا) - O zaman ki müəyyən vaxt** (qiyamət günü) **gəlib yetişdi, həqiqətən, Allah-Təala öz bəndələrinin hər bir əməllərinə agah olduğu üçün hər bir şəxsin xeyir və şər əməlinin qarşılığını ona verəcəkdir.**

**Allaha həmd olsun, Məlaikə surəsinin təfsiri tamamlandı. İslam ümməti diqqətli nəzərlərlə bu mübarək surəyə baxıb, qiyamətin vaqe olacağına şəkk-şübhə etməyib, əməllərinin qarşılığını görəcəklərinə inanıb, xəbis sifətləri, zülmü özlərinə şüar seçməsinlər. Allahın Rəsulu buyurubdur: "Kim Məlaikə surəsini oxusa** (ona əməl edə və qiyamətə inansa), **axirətdə behiştin səkkiz qapısı onu çağırıb deyərlər: "Hansı birindən daxil olursan ol". Bunu arzulayanlara müjdə olsun!"**

## YASİN SURƏSİ

36-cı surədir. Məkkədə nazil olub, 83 ayə, 729 kəlmə və 3000 hərfdir.

يٰسٓ ﴿١﴾ وَالْقُرْاٰنِ الْحَك۪يمِۙ ﴿٢﴾ اِنَّكَ لَمِنَ الْمُرْسَل۪ينَۙ ﴿٣﴾ عَلٰى صِرَاطٍ مُسْتَق۪يمٍۜ ﴿٤﴾ تَنْز۪يلَ الْعَز۪يزِ الرَّح۪يمِۙ ﴿٥﴾ لِتُنْذِرَ قَوْمًا مَٓا اُنْذِرَ اٰبَٓاؤُ۬هُمْ فَهُمْ غَافِلُونَ ﴿٦﴾ لَقَدْ حَقَّ الْقَوْلُ عَلٰٓى اَكْثَرِهِمْ فَهُمْ لَا يُؤْمِنُونَ ﴿٧﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (يٰسٓ) - İbn Abbas deyib: "Mənası "ya insan"dır və ya Allahın Rəsuluna olan xitabdır, yəni, ey Məhəmməd!"**

**2) (وَالْقُرْاٰنِ الْحَك۪يمِۙ) - And olsun hikməti ehtiva edən bu Qurana!**

**3-4) (اِنَّكَ لَمِنَ الْمُرْسَل۪ينَۙ عَلٰى صِرَاطٍ مُسْتَق۪يمٍۜ) - Həqiqətən, də sən düz və haqq olan yola göndərilən peyğəmbərlərdənsən, peyğəmbərlər hamısı düz və haqq yoldadırlar. Sən də (ey Məhəmməd), onlardan birisən. Kafirlər xəyal edib dediyi kimi deyil ki, guya, sən Allah-Təala tərəfindən göndərilməmisən.**

**5) (تَنْز۪يلَ الْعَز۪يزِ الرَّح۪يمِۙ) - Bu Quran elə bir Allah-Təala tərəfindən göndərilibdir ki, onun nəzminin fəsahət və bəlağəti inadkarların şübhələrinə qalib gəlir. Haqq və hidayət yolçularına rəhm edib Qurani-Şərifdə varid olan xitabətin incə mənası ilə onların idrakını cəzb edir.**

**6) (لِتُنْذِرَ قَوْمًا مَٓا اُنْذِرَ اٰبَٓاؤُ۬هُمْ فَهُمْ غَافِلُونَ)** - (Ey Məhəmməd), **bu Quranı sənə göndərdik ki, bizim əzabımızla qorxudasan bu Qüreyş camaatını, hansı ki, onların ata-babalarına səndən əvvəl bir peyğəmbər gəlməyib və haqdan qafil olublar.** (Qüreyş camaatının Allahın Rəsulu ilə babası İsmayıl arasındakı dövrdə yaşayan ata-babalarına peyğəmbər göndərilməməsi qeyd olunur).

**7) (لَقَدْ حَقَّ الْقَوْلُ عَلٰٓى اَكْثَرِهِمْ فَهُمْ لَا يُؤْمِنُونَ)** - (Ey Məhəmməd), **bu Qüreyş camaatının əksəriyyəti küfr və inadlarında qalıb, onlara verilən hökm tamamlanıb, ölüm onlara gələn vaxt həqiqətən Allah-Təalanın əzabı onlara vacib və sabit oldu.** (Kafir və müşriklər küfrlərində sabit və bərqərar olub, imana daxil olmadıqları üçün Allah-Təala növbəti ayədə onlardan ötrü məsəl bildirib, onları oxşadır o şəxslərə ki, onların başlarına zəncir vurulub və o zəncirin həlqələri onların çənələrini elə möhkəm sıxıb ki, başlarını hərəkət etdirməyə qadir olmurlar).

اِنَّا جَعَلْنَا فٖيٓ اَعْنَاقِهِمْ اَغْلَالًا فَهِيَ اِلَى الْاَذْقَانِ فَهُمْ مُقْمَحُونَ ﴿٨﴾ وَجَعَلْنَا مِنْ بَيْنِ اَيْدٖيهِمْ
سَدًّا وَمِنْ خَلْفِهِمْ سَدًّا فَاَغْشَيْنَاهُمْ فَهُمْ لَا يُبْصِرُونَ﴿٩﴾ وَسَوَٓاءٌ عَلَيْهِمْ ءَاَنْذَرْتَهُمْ اَمْ لَمْ تُنْذِرْهُمْ
لَا يُؤْمِنُونَ ﴿١٠﴾ اِنَّمَا تُنْذِرُ مَنِ اتَّبَعَ الذِّكْرَ وَخَشِيَ الرَّحْمٰنَ بِالْغَيْبِۚ فَبَشِّرْهُ بِمَغْفِرَةٍ وَاَجْرٍ كَرٖيمٍ
﴿١١﴾ اِنَّا نَحْنُ نُحْيِ الْمَوْتٰى وَنَكْتُبُ مَا قَدَّمُوا وَاٰثَارَهُمْۜ

---

**8) (اِنَّا جَعَلْنَا فٖيٓ اَعْنَاقِهِمْ اَغْلَالًا فَهِيَ اِلَى الْاَذْقَانِ فَهُمْ مُقْمَحُونَ)** - (Ey Məhəmməd), **həqiqətən, biz kafir və müşriklərin boyunlarına zəncirlər vurmuşuq ki, o zəncirlərin həlqələri onların çənələrinə çatıb elə sıxır ki, başları yuxarıda qalıb, gözlərini örtüb, başlarını aşağı salmağa və ya bir tərəfə hərəkət etdirməyə qadir olmazlar,** (belədir bu kafir və cahillərin əhvalı, küfr və şirk zəncirinin həlqələri onların ən qiymətli bədən üzvü olan başlarını və onun malik olduğu xüsusiyyətlərini işlədib, haqq tərəfinə baxıb, söz eşitmələrinə mane olub, çaşqınlıq və zəlalətdə qalıblar).

**9) (وَجَعَلْنَا مِنْ بَيْنِ اَيْدٖيهِمْ سَدًّا وَمِنْ خَلْفِهِمْ سَدًّا)** - (Ey Məhəmməd), **müşriklərin inadlarına görə qabaq tərəflərindən və arxa tərəflərindən sədd çəkdik ki, küfr sədlərinin içində qalıb haqq yola hidayət tapmazlar.**

**(فَاَغْشَيْنَاهُمْ فَهُمْ لَا يُبْصِرُونَ) - Onların gözlərinə küfr pərdələrini saldıq və bu səbəbdən heç bir şey haqdan görməzlər.**

**10) (وَسَوَٓاءٌ عَلَيْهِمْ ءَاَنْذَرْتَهُمْ اَمْ لَمْ تُنْذِرْهُمْ لَا يُؤْمِنُونَ)** - (Ey Məhəmməd), **indi bundan belə kafir və müşriklərdən ötrü fərqi yoxdur, sən onlara xəbərdarlıq edib, bizim tərəfimizə dəvət edəsən, ya etməyəsən, onlar imana daxil olan deyildir.**

**11) (اِنَّمَا تُنْذِرُ مَنِ اتَّبَعَ الذِّكْرَ وَخَشِيَ الرَّحْمٰنَ بِالْغَيْبِۚ)** - (Ey Məhəmməd), **sənin xəbərdarlığın o şəxslərə təsir edər ki, Qurana tabe olub, Rəhman sifətinə malik olan Allah-Təalanı görməsələr də, ondan qorxub, imana daxil olarlar. (فَبَشِّرْهُ بِمَغْفِرَةٍ وَاَجْرٍ كَرٖيمٍ)** - (Ey Məhəmməd), **belə şəxsi bizim tərəfimizdən bağışlanıb, gözəl savab və mükafatla (cənnətlə) müjdələ.**

**12) (اِنَّا نَحْنُ نُحْيِ الْمَوْتٰى)** - (Ey Məhəmməd), **həqiqətən, cahilləri dirildib məhşərə hazır edən bizik. (وَنَكْتُبُ مَا قَدَّمُوا وَاٰثَارَهُمْ) - Onların əvvəlcədən göndərdiklərini - xeyir və şər əməllərini və özlərindən sonra* qoyduqları yaxşı, yaman əsərlərinin hamısını** (kitab yazan kimi) **yazıb, qoruyub, qarşılığını onlara verərik.**

*(*Qeyd: "Müsəlmanlar, xüsusən, rəhbərlər və zənginlər bu mübarək ayəyə diqqət edib özlərindən sonra xeyirli əsərlər qoysunlar, bir şəxsin dünyada özündən sonra xeyirli əsərlər qoyması bütün xeyir əməllərindən fəzilətlidir. Hər bir xeyir əməl ki, onun faydası ümumi oldu, o əməl hər bir xeyir əməldən fəzilətli və kamildir. Dünyada rəhbərlərin, alimlərin və zənginlərin heç bir*

*xeyir əməli insanlığa və millətin övladlarına xidmət edib, imkanı çatdığı qədər onların ehtiyaclarını həll etmədə səy və cəhd edib, xüsusən, zəlalətdən hidayətə, cəhalətdən elmə yönəltməkdən gözəl ola bilməz. Məsələn, alimlər hər bir zaman ehtiyaca görə, onlardan ötrü kitablar yazsa, o kitablarda verilən elmlər də onları bəsirət sahibi edib, dünya və axirət üçün xeyir və şərri dərk edib, zəlalət və cəhalətdən çəkinsələr, yaxşıdır, nəinki o kitabların səbəbinə daha da zəlalətləri artıb, əbədiyyən həlak olalar. Bizim islam ümməti arasında dəyərli sayılan və son 200 il içində yazılan kitabların əksəriyyəti gərək islam ümməti tərəfindən tərk olunsun ki, bəlkə cəhalət, yalan, böhtan və iftiralar bu kitabların məhv olması ilə müsəlmanların arasından götürülüb, hidayətə daxil olsunlar. Hər bir dildə ki, kitab yazılsa, gərək, o milləti hidayətə çatdırıb, zəlalətdən xilas etsin. Amma bizim qeyd etdiyimiz kitabların işi əksinədir. Bu qədər şər və pislik və cəhalət ki, bu zamanda islam ümməti arasında müşahidə olunur, hamısı o kitablarda olan küfr və xalqı cəhalətə sövq edən yalan sözlərdəndir. Mübarək Ramazan və ya Məhərrəm ayında əlinə Quran götürüb, minbərə çıxıb, xalqı haqq tərəfinə dəvət edən şəxsi (əgər mövcud olsa) tərk edib, mərsiyəxan adlanan bir yalançı və iftiraçı meymunun başına yığılıb, onun sözlərini vəhy kimi qəbul edib, özlərini uca firdövs cənnətlərində hurilər ilə qucaqlaşmış hiss edirlər. Təmiz əhli-beytin, xüsusilə onlardan beş nəfərin ehtiramını pozmağı özlərinə qazanc sayıb, o xəbisin pis boğazından çıxan fəsadçı nəğmənin səbəbi ilə ona aldananların gözlərindən axan bir damcı yaşa firdövs cənnətini satıb, onlar da o alış-verişə şad olub: “Qarşılığında özlərini satdığı şey nə pisdir” -mübarək ayəsini də unudub, özlərini qurtulmuş və ikinci dərəcəli peyğəmbər səviyyəsində güman edərlər. Gərək bu zəlil və alçaq qrupun kökünü qoparıb - “Beləliklə, zülm edən camaatın kökü kəsildi, aləmlərin rəbbi olan Allaha həmd olsun!” mübarək ayəsini oxumaq lazımdır, bu camaatdan da betər, bunları yayan hənif dini olan islamın alim adlanan düşmənləridir. Nə pis zəmanəyə düçar olduq, doğru və haqq deyənlər zəlil və qovulmuş, yalan və böhtan deyənlər möhtərəm və əziz olublar. Görəsən, islam ümməti ilə digər millətlərin ağıllarında fərq varmı? İslam ümmətinin ağlı əskikdirmi? Bəlkə, buna görə yalan və iftiralara aldanıb, elm əvəzinə cəhaləti seçirlər? Ya da ki özləri öz cəhalətlərinə səbəb olduqları üçün Allah-Təala onlara qəzəb edib, yer kürəsində olan millətlərin əksəriyyətinə rəis, hakim və müəllim olandan sonra qayıdıb, bir sahibsiz qoyun sürüsü kimi olublar ki, hər bir tərəfdən zahiri ilan dərisi kimi yumşaq, batinləri zəhərlə dolu, hər bir yırtıcı sifətlər onları bir-birindən ayırıb, ondan sonra yırtıb-dağıdırlar, bugünkü gündə demək olar ki, islam ümmətinin, xüsusən, bir qrupun rəftar və əmlləri hamısı yalan üzərinə qurulubdur. Heç bir əməlləri islam əməlinə oxşamayıb, islamın qanunu olan Qurani-Şərifə uyğun deyildir. Bu bəyənilən kitaba baxanlardan xahiş olunur ki, bu bəhs olunan mətləblərə inad və həsəd nəzərilə baxmayıb, bəlkə, insaf nəzərilə diqqət edib həqiqəti dərk*

وَكُلَّ شَيْءٍ اَحْصَيْنَاهُ فِيٓ اِمَامٍ مُبِينٍ ﴿١٢﴾ وَاضْرِبْ لَهُمْ مَثَلًا اَصْحَابَ الْقَرْيَةِۢ اِذْ جَٓاءَهَا الْمُرْسَلُونَۚ ﴿١٣﴾

*etsinlər, ağıl sahibləri bu mətləbi uzatdığı üçün mən həqirin təqsirini üzrlü sayıb əfv etsinlər. Bundan sonra məna əhli olan şəxslərə bu mətləbləri aşkar edib onların uca məzmununu avam camaata təlqin etmələri tövsiyə olunur. Bundan sonra varlılar barəsində danışaq. Varlılar qüdsi hədisdə deyildiyi kimi, Allah-Təalanın yer üzündəki vəkilidirlər. Əgər vəkil onu təyin edənin əmrindən çıxsa, gərək öz vəkilliyindən qovulsun. Varlıların etməsi gərəkən şey millətin övladlarının maarifi və tərəqqisi yolunda var-dövlət xərcləyib, onları cəhalətdən xilas etməkdir. Xüsusən yetimlərə tərbiyə verib, onları doğru yola və kamilliyə çatdırmaqdır. Mədrəsələr, məktəblər tikib, onları vəqf etmək fərz dərəcəsindədir. Dünya malını yığıb, anbarlarda saxlamaq günah və əzabdan başqa heç bir şeyi varlılardan ötrü geridə qoymaz. Əlində Quran oxuyub, amma qızıl sandığının üstündə oturan şəxslər Quranın ona lənət etməyindən bixəbər olub, öz əməllərini xeyirli sayırlar. Quran oxumaq fərz deyildir. Onun itaət edilməsi vacib olan ehkamına əməl etmək fərzdir. Gərək varlılar "Qızıl və gümüşü yığıb, onları Allah yolunda xərcləməyənləri əziyyət verən bir əzabla müjdələ!" ayəsindən qafil olmayıb, külli varlığın yaradıcısı olan Allahın vəkili olmaqdan imtina etməsinlər).*

**(وَكُلَّ شَيْءٍ اَحْصَيْنَاهُ فِيٓ اِمَامٍ مُبِينٍ) -** (Ey Məhəmməd), **hər bir şeyi ki yazıb qoruyaq, lövhi-məhfuzda** (ilahi elm) **sabit və bərqərardır. Əbədiyyən ondan ötrü unudulma və məhv olmaq yoxdur.**

**13) (وَاضْرِبْ لَهُمْ مَثَلًا اَصْحَابَ الْقَرْيَةِۢ اِذْ جَٓاءَهَا الْمُرْسَلُونَ) -** (Ey Məhəmməd), **bu Qüreyş camaatı ki, səni təkzib edirlər, bir bölgə əhlinin təəccüblü olan qissəsini onlardan ötrü bəyan et. O zaman ki bizim tərəfimizdən göndərilən şəxslər** (peyğəmbərlər) **onları dəvət etmək üçün gəldilər,** (təfsirçilər bu ayənin və bundan sonrakı bəzi ayələrin təfsirində belə deyiblər ki, o şəxslərdən məqsəd İsanın (ə.s) göndərdiyi şəxslərdir ki, onları Antakya əhlinə göndərmişdi. Onlardan ötrü uzun hekayələr və möcüzələr nəql ediblər. Ayə o hekayə və möcüzələrə heç bir şəkildə işarə etmir. Quran ayələrini əsli olmayan bir mətləbə aid etmək layiq deyildir. Bəlkə, məqsəd bir neçə nəfər peyğəmbərin əhvalatından bəhs etməkdir ki, onların adlarını Allah-Təala xəbər verməyib, qeyri-müəyyən qoyubdur və onların da heç bir möcüzəsindən bəhs etməyibdir. Ayəni İsaya (ə.s) aid edənlər belə deyirlər: "Cənab İsa iki nəfər həvarisini Antakya əhlini dəvət etməyə göndərdi. Onlar gedib şəhərin kənarında qoyun otaran bir qoca kişi ilə rastlaşdılar, o kişinin adı Həbibi Nəccardır, o kişi onların əhvalatını soruşdu. Dedilər: "İsa tərəfindən xalqı Allah-Təala tərəfinə dəvət etmək üçün göndərilmişik". Həbibi Nəccar dedi: "Bəs sizin bir möcüzəniz varmı?" Dedilər: "Naxoşa şəfa veririk". Həbibi Nəccarın iki ildən bəri bir naxoş oğlu var idi. Onları o naxoşun yanına apardı.

Onlar əllərini o naxoşun bədəninə sürtdülər, naxoş şəfa tapıb ayağa qalxdı. Həbibi onlara iman etdi. Onların əməlləri məşhur olub, bir çox adam onların əllərindən şəfa tapdılar. Onların xəbəri padşaha çatdı. Padşah onları hüzuruna gətizdirib dedi: “Bəs bizim tanrılar və bütlərdən başqa da bir tanrı varmı? Dedilər: “Bəli, bu, o tanrıdır ki, səni və sənin bütlərini meydana gətiribdir. Padşah dedi: “Gedin, mən sizin işinizə baxaram”. Xalq onların dalınca düşüb, onları vurub əziyyət etdilər. Ondan sonra padşah əmr etdi, onları həbs etdilər. O tərəfdən İsa cənabları öz həvarilərinin rəisi Şəmunu o iki nəfərə kömək göndərdi. Şəmun gedib dövlət adamları ilə və məmləkətin əyanları ilə gözəl münasibətlər qurdu. Onun fəzilət və kamalını görüb padşaha xəbər verdilər. Padşah onu hüzuruna dəvət edib, onunla danışıb, onu kamalı səbəbi ilə bəyəndi. Bir gün padşaha dedi: “Eşitmişəm iki nəfəri həbs edibsən, bəs onların sözlərini eşidibsən ki, nə deyirlər, yoxsa yox?” Padşah dedi: “Qəzəb məni tutdu, onlarla heç danışmadım. Şəmunun xahişinə görə padşah hökm verdi, onları gətirdilər. Şəmun onlara dedi: “Sizi bu yerlərə kim göndəribdir?” Dedilər: “Allah-Təala ki hər bir şeyi yaradıb və ona şərik yoxdur, bizi o göndəribdir”. Şəmun dedi: “Allah-Təalanı müxtəsər şəkildə vəsf edin”. Dedilər: “Hər bir iş istəsə edər, iradəsi ilə ona hökm edər. Şəmun dedi: “Sizin möcüzəniz nədir?” Dedilər: “Hər bir şeyi ki, padşah xahiş etsə, edərik”. Padşah hökm verdi, gözünün biri olmayan bir şəxsi gətirdilər. Dedi: “Bunun gözlərini açın”. Onlar dua etdi, o şəxsin göz yeri açıldı. Palçıqdan göz bəbəyi şəklində bir kürə düzəldib onun gözünün yerinə qoydular. Gözü nurlanıb gördü. Şəmun padşaha dedi: “Sən də digərlərindən xahiş et, belə bir  kəramət və möcüzə onlardan meydana gəlsin ki, tanrılardan və səndən ötrü bir şərəf sayılsın”. Padşah dedi: “Mənim səndən gizli bir sirrim yoxdur. Bizim tanrılarımız  xeyir və mənfəət verməyən şeylərdir”. Ondan sonra padşah onlara dedi: “Əgər sizin məbudunuz bir ölünü diriltməyə qadir olsa, mən ona iman edərəm. 7 gün əvvəl cavan ölən bir meyiti gətirdilər. Dua etdilər, o cavan dirilib ayağa durdu. Dedi: “Məni aparıb cəhənnəmin yeddi vadisinə daxil etdilər. Ondan sonra göyün qapıları açıldı. Baxıb gördüm, bir xoş surətli cavan bu 3 nəfərdən ötrü şəfaət edir. Padşah dedi: “3 nəfər kimdir? Burada 2 nəfərdir”. O cavan dedi: “Bu 2 nəfər, bir də bu şəxs. Şəmunu işarət etdi. Padşah bu işə təəccüb etdi. Çünkü Şəmunu özü kimi sayırdı. Şəmun baxdı gördü, onların sözü padşaha təsir edibdir. Padşaha nəsihət edib onu haqq dinə dəvət etdi. Padşah iman gətirib, camaatın bir qismi də ona tabe olub iman etdilər. İman etməyənləri Cəbrayıl dəhşətli bir səs ilə vurub hamısı həlak oldu. Müxtəsər şəkildə bəhs etdim, yoxsa hekayə  uzundur).  Ayə ilə əlaqəli bu əhvalat qəti şəkildə məqbul deyildir. Bir çox cəhətdən səhvdir. Birincisi, ayədə nə İsa, nə də həvarilərdən bəhs edilmir. Əksinə, ayə Allah-Təala tərəfindən göndərilən bir neçə peyğəmbərin əhvalatına işarədir. Hansı ki onların adlarını məxfi saxlayıb qeyd etməyibdir. Həm də ki, İsanın (ə.s) həyat tarixindən agah olanlar bu xəbərin səhv olduğunu görərlər. Cənab

اِذْ اَرْسَلْنَٓا اِلَيْهِمُ اثْنَيْنِ فَكَذَّبُوهُمَا فَعَزَّزْنَا بِثَالِثٍ فَقَالُوٓا اِنَّٓا اِلَيْكُمْ مُرْسَلُونَ ﴿١٤﴾ قَالُوا مَٓا اَنْتُمْ اِلَّا
بَشَرٌ مِثْلُنَاۙ

---

İsa iki il yarım peyğəmbərlik edib, bu müddətin çoxunu səhralarda olub, nə özü, nə də həvariləri heç kimi dəvət etməkdən ötrü bir yerə getməyiblər. Bu mətləbi heç bir şəxs inkar edə bilməz. Cənab İsa xalqa deyirdi: “Dünyadan əl çəkib, mənim dalımca səhralara gəlin”, nə zaman vaxtı oldu ki, şəhərlərə elçi göndərib xalqı dəvət etsin? Onun din və ümməti özündən sonra rəvac tapıbdır, ikincisi də Antakya əhli ərəb deyildir. Həbibi ərəb adıdır. O zaman ərəb camaatı Yəməndə və Məkkə ətrafında yaşayırdı. Antakyaya Həbibi adlı şəxs haradan gəldi? Üçüncüsü də, o adamlar ki, hər bir xəstəyə şəfa verib ölünü diriltsin, onları döymək, vurmaq ağılsızlıqdır. Belə şəxslərə xalq cani-dildən fəda olarlar. Bir şəhərdə bir məşhur həkim olanda o şəhərin əhalisi tamamilə onu mədh edib, əziz və hörmətli şəxs sayarlar. Nəinki onu döyüb, vurub, əziyyət və əzab edərlər. Haris ibn Kəldə ərəb camaatının həkimi idi. Bütün ərəblər arasında möhtərəm bir şəxs olub hələ islam dininə daxil olmamışdı. Allahın Rəsulu (s.a.v.) onu əziz və hörmətli sayıb, müalicədən ötrü onu həmişə yanına çağırardı. Belə mənasız sözlərin adını hədis qoymaq nadanlıqdır. Dördüncüsü də, Qurani-Şərifin hökmüylə Allah-Təala bəzi böyük peyğəmbərlərdən hər birinə elə bir möcüzə bəxş edibdir ki, o möcüzə o birində olmayıbdır. Lakin bu xəbərdən belə məlum olur ki, həvarilər peyğəmbər olmasalar da, onlardan hər bir möcüzə zühur edirdi, necə ki bəhs olundu: “Şəmun onlardan soruşanda ki, sizin möcüzəniz nədir?” Dedilər: “Hər bir möcüzə ki padşah istəsə göstərərik”. Halbuki Allahın Rəsulu kimi misilsiz bir şəxsdən möcüzə istəyəndə Qurani-Şərifdə onları rədd etmək üçün ayə gəlmişdi. Və beşincisi, Cəbrayılın qorxunc səsi ilə şəhərin bir hissəsinin həlak olub, bir hissəsinin sağ qalması ağla ziddir və halbuki Qurani-Şərifdə verilən xəbərlərə görə hansı xalqa ki, əzab göndərilib, onların arasında olan saleh şəxslərə onların arasından çıxmaq əmr olunubdur. Təfsirçilərin bu hekayəni həvəslə qəbul etməsi təəccüblüdür. Anlayın və təfəkkür edin).

**14) (اِذْ اَرْسَلْنَٓا اِلَيْهِمُ اثْنَيْنِ فَكَذَّبُوهُمَا)** - (Ey Məhəmməd), **o zaman ki o bölgənin əhalisinə biz iki nəfər peyğəmbər göndərdik, o peyğəmbərlərin hər ikisini təkzib etdilər. (فَعَزَّزْنَا بِثَالِثٍ فَقَالُوٓا اِنَّٓا اِلَيْكُمْ مُرْسَلُونَ)** - (Ey Məhəmməd), **üçüncü peyğəmbər göndərməklə o iki nəfərə qüvvət verdik, hər üçü cəm olub bir-birinə qüvvət verib, o camaata dedilər ki, həqiqətən, biz Allah-Təala tərəfindən sizə göndərilmişik. Bizim sözümüzü qəbul edib Allah-Təalaya iman edib, şirki tərk edin.**

**15) (قَالُوا مَٓا اَنْتُمْ اِلَّا بَشَرٌ مِثْلُنَاۙ) - Müşriklər peyğəmbərlərin cavabında dedilər: “Siz də bizim kimi insansınız, insandan peyğəmbər olmaz.**

وَمَٓا اَنْزَلَ الرَّحْمٰنُ مِنْ شَيْءٍۙ اِنْ اَنْتُمْ اِلَّا تَكْذِبُونَ ﴿١٥﴾ قَالُوا رَبُّنَا يَعْلَمُ اِنَّٓا اِلَيْكُمْ لَمُرْسَلُونَ ﴿١٦﴾
وَمَا عَلَيْنَٓا اِلَّا الْبَلَاغُ الْمُبِينُ ﴿١٧﴾ قَالُوٓا اِنَّا تَطَيَّرْنَا بِكُمْۚ لَئِنْ لَمْ تَنْتَهُوا لَنَرْجُمَنَّكُمْ وَلَيَمَسَّنَّكُمْ مِنَّا
عَذَابٌ اَلِيمٌ ﴿١٨﴾ قَالُوا طَائِرُكُمْ مَعَكُمْۜ اَئِنْ ذُكِّرْتُمْۜ بَلْ اَنْتُمْ قَوْمٌ مُسْرِفُونَ ﴿١٩﴾ وَجَٓاءَ مِنْ اَقْصَا
الْمَدِينَةِ رَجُلٌ يَسْعٰى

---

**(وَمَٓا اَنْزَلَ الرَّحْمٰنُ مِنْ شَيْءٍۙ اِنْ اَنْتُمْ اِلَّا تَكْذِبُونَ) - Rəhman olan Allah-Təala sizə heç bir şey göndərməyib, peyğəmbərlik iddiası ki, edirsiniz, yalançısınız.**

**16) (قَالُوا رَبُّنَا يَعْلَمُ اِنَّٓا اِلَيْكُمْ لَمُرْسَلُونَ) - Peyğəmbərlər onların cavabında dedilər: "Hərçənd siz bizim peyğəmbər olmağımızı inkar edirsiniz, amma bizim Allah-Təala agahdır ki, biz yalançı deyilik və həqiqətən, Allah-Təala tərəfindən sizə göndərilmişik.**

**17) (وَمَا عَلَيْنَٓا اِلَّا الْبَلَاغُ الْمُبِينُ) - Sizi Allah-Təala tərəfinə dəvət etməkdən başqa, bizə bir şey lazım deyil və sizə qarşı da güc işlətmərik. Ancaq Allah-Təalanın hökmlərini bizim doğruluğumuza işarə edən açıq-aşkar dəlillərlə sizə yetirmək lazımdır. Qəbul edib-etməməkdə bizim sizə qarşı heç bir hökmümüz yoxdur".**

**18) (قَالُوٓا اِنَّا تَطَيَّرْنَا بِكُمْ) - Müşriklər peyğəmbərlərin cavabında dedilər: "Həqiqətən, fal sizi uğursuz göstərib, sizdən bizə bəla gəlir. Bizdən kənar olun.** (Cahil və nadan şəxslərin hər hansı bir şeyə ki, meyli oldu, fal açıb, onu xeyirli sayar, qəbul edərlər, hər hansı bir şeyə ki nifrət edib, meyilləri olmadı, yenə fal açıb, onu bəd sayar, tərk edərlər. Din və ilahi ehkamlar cahil və nadan şəxslərə ağır gəlib, təbiətləri ondan çəkindiyi üçün, peyğəmbərlərin müqəddəs varlıqlarını falla şərə nisbət edib onların möcüzəli kəlamlarını rədd etdilər). **(لَئِنْ لَمْ تَنْتَهُوا لَنَرْجُمَنَّكُمْ وَلَيَمَسَّنَّكُمْ مِنَّا عَذَابٌ اَلِيمٌ) - Ey peyğəmbərlik iddia edənlər, əgər dediyiniz sözləri tərk etməyib bizdən kənar olmasanız, əlbəttə, sizi daşlayıb, rəzil və zəlil edən əzab bizdən sizə yetişəcəkdir".**

**19) (قَالُوا طَائِرُكُمْ مَعَكُمْ) - Peyğəmbərlər müşriklərin cavabında dedilər: "Falla bəd və bəlaya nisbət etmək sizin özünüzdən olan küfrdür, ondan başqa, hər bir uğursuzluq və bəla sizə yetişsə, sizdə olan küfr səbəbi ilədir. Allah-Təalanın peyğəmbərlərindən uğursuzluq və bəla meydana gəlməz. (اَئِنْ ذُكِّرْتُمْ) - Sizə vəz edib, Allah-Təala tərəfinə dəvət etdiyimiz üçün bizi falla bəd sayıb, uğursuz hesab edirsiniz? Ağıllı şəxs belə əməl edərmi? (بَلْ اَنْتُمْ قَوْمٌ مُسْرِفُونَ) - Bəlkə də siz zəlalətdə olan və Allah-Təalaya çox asi olan bir camaatsınız. O səbəbdən Allah-Təala peyğəmbərlərini falla xeyirli saymaq əvəzinə bəd saydınız".**

**20) (وَجَٓاءَ مِنْ اَقْصَا الْمَدِينَةِ رَجُلٌ يَسْعٰى) - Peyğəmbərlər müşriklərlə danışan əsnada şəhərin kənarından bir kişi təcili gəlib varid oldu.** (Bu kişi pey-

قَالَ يَا قَوْمِ اتَّبِعُوا الْمُرْسَلِينَ ۙ ﴿٢٠﴾ اِتَّبِعُوا مَنْ لَا يَسْـَٔلُكُمْ اَجْرًا وَهُمْ مُهْتَدُونَ ﴿٢١﴾ وَمَا لِيَ لَآ اَعْبُدُ الَّذِي فَطَرَنِي وَاِلَيْهِ تُرْجَعُونَ ﴿٢٢﴾ ءَاَتَّخِذُ مِنْ دُونِهٖٓ اٰلِهَةً اِنْ يُرِدْنِ الرَّحْمٰنُ بِضُرٍّ لَا تُغْنِ عَنِّي شَفَاعَتُهُمْ شَيْـًٔا وَلَا يُنْقِذُونِ ۚ ﴿٢٣﴾

---

ğəmbərlərin sözlərinə diqqət edib, onların haqlılığı ondan ötrü aydın oldu, peyğəmbərlərdən əks edən iman nuru onun qəlbinə işıq salıb müşrikləri haqq tərəfinə dəvət etməyə başladı). **(قَالَ يَا قَوْمِ اتَّبِعُوا الْمُرْسَلِينَ) - Şəhərin kənarından gələn kişi xalqına xitab edib dedi: "Ey mənim xalqım, bunlar Allah-Təala tərəfindən göndərilən şəxslərdir, gəlin Allah-Təala tərəfindən göndərilən peyğəmbərlərə tabe olub iman edək.**

**21) ( اِتَّبِعُوا مَنْ لَا يَسْـَٔلُكُمْ اَجْرًا وَهُمْ مُهْتَدُونَ ) - Ey mənim xalqım, tabe olun bu şəxslərə ki, sizdən dünya malı və əcr, muzd* istəmirlər ki, malınıza zərər gəlsin, özləri də sizi hidayət edib Allah-Təala tərəfinə dəvət edirlər, bunlara tabe olmaqda həm dünya, həm axirət mənfəəti vardır. Əlbəttə, gərək bunlara tabe olub dünya və axirətdə xeyirli olan şeyi dərk edəsiniz, bunlara müxalifət etmək ağıllı şəxslərin əməli deyil.** (Şəhərin kənarından gələn şəxsin müşriklərə bildirməsi ki, hər bir şey ki sizdən ötrü istəyirəm onu özümdən ötrü də istəyib məqsədim sizə nəsihət etməkdir - növbəti ayənin məzmunu onlara işarə edir).

*(*Qeyd: "Həqiqətən nəsihətçi və vaizin vəz və nəsihətinin təsirli olmasında onun əcr, muzd qayəsinin olması necə ki bizim zamanımızda belədir, nə böyük manedir, dünya malı nəfsdən qiymətli olduğu üçün Haqq-Təala tərəfindən göndərilən nəsihətçilər elə birinci sözlərindən əcr, muzd istəməzlər ki, tamahkarlıqla töhmət edilməyib, Allah-Təalanın ehkamını və haqq sözü deməkdə cəsarətli olsunlar. Həqiqətən də, belədir. Nəsihət və vəzdə birinci şərt xalqın malında gözün olmayıb, tamahkarlığı tərk etməkdir və bu səbəbdən bizim zamanımızda vaizlərinin sözləri ilə (Elə bil qoz günbəzin üstündədir.) islam dininin geri getməyinə bir səbəb də həmin mətləbdir. Peyğəmbərlərin doğruluğuna bir dəlil də peyğəmbərliyin təbliği üçün muzd almamalarıdır).*

**22) (وَمَا لِيَ لَآ اَعْبُدُ الَّذِي فَطَرَنِي وَاِلَيْهِ تُرْجَعُونَ) - Ey müşriklər, nə olubdur mənə və nə mane olur mənə ki, ibadət etməyim bir olan Allah-Təalaya, hansı ki, məni yoxdan yaradıbdır və siz hamınız onun tərəfinə qayıdacaqsınız. Əlbəttə, belə Allah-Təalaya, gərək, ibadət edək.**

**23) (ءَاَتَّخِذُ مِنْ دُونِهٖٓ اٰلِهَةً) - Ey müşriklər, bəs bu layiqdir ki, mən yeganə olan Allah-Təaladan başqa özümə məbudlar seçim?**

**(اِنْ يُرِدْنِ الرَّحْمٰنُ بِضُرٍّ لَا تُغْنِ عَنِّي شَفَاعَتُهُمْ شَيْـًٔا وَلَا يُنْقِذُونِ ۚ) - Hansı ki əgər Rəhman olan Allah-Təala mənə bir zərər yetirmək istəsə, o məbudların şəfaəti mənə heç bir fayda verməyib, Allah-Təalanın zərərindən və əzabından məni xilas edə bilməzlər. Bəs belə şeylərə ibadət etmək layiqdirmi?**

اِنّ۪ٓي اِذًا لَف۪ي ضَلَالٍ مُب۪ينٍ ﴿٢٤﴾ اِنّ۪ٓي اٰمَنْتُ بِرَبِّكُمْ فَاسْمَعُونِۜ ﴿٢٥﴾

**24) (اِنّ۪ٓي اِذًا لَف۪ي ضَلَالٍ مُب۪ينٍ) - Əgər mən Allah-Təaladan başqa özümə məbudlar seçsəm, həqiqətən, o vaxt açıq-aşkar zəlalətdə olaram ki, heç bir ağıl sahibinə məxfi qalan deyildir.** (Elə ki o şəxs öz xalqına bu nəsihətləri etdi, hamısı başladı onu* daşla vurub öldürməyə, o zaman üzünü peyğəmbərlərə tutub sıyadakı ayənin məzmununu onlara xitab etdi).

**25) (اِنّ۪ٓي اٰمَنْتُ بِرَبِّكُمْ فَاسْمَعُونِۜ) - Ey peyğəmbərlər, həqiqətən, mən sizin rəbbiniz Allah-Təalaya iman etdim. Məndən eşidib şahidim olun.**

*(***Qeyd:** "Daş dövründə hər bir hərb alətini daşdan düzəldib, bir şəxsi qətlə yetirəndə daşla qətlə yetirərdilər. Qabil Habili daşla öldürdü. Cənab İbrahim (ə.s) 90 yaşında özünü daşdan bıçaqla sünnət etdi və daşdan bıçaqla oğlu İsmayılı kəsməyə çalışdı. Ondan sonra bürünc dövrü gəlib, hər bir şeyi bürüncdən düzəldirdilər. Ondan sonra dəmir dövrü zühura gəldi, indiyə qədər də hər bir şeyi dəmirdən istehsal edirlər. "Biz dəmiri göndərdik ki, onda böyük bir qüvvət və insanlar üçün faydalar vardır," -ayəsinin doğruluğu meydana çıxdı. Ola bilər ki, peyğəmbərlərin əhvalatı daş dövründə vaqe olduğu üçün o kişini daşla qətlə yetirdilər. Daşla qətlə yetirməyin əzabı oddan başqa digər əzablardan artıq əziyyət verdiyi üçün Tövratda açıq-aşkar zina edən şəxsin cəzası daşlanma olaraq əmr edilmişdir. Uca peyğəmbərimiz həmin hökmdə Tövrata tabe olub açıq-aşkar zinanın cəzasını "rəcm" (daşlayıb öldürmə) şəklində əmr etdi. O ki islam ümmətinə iftira edib deyirlər: "İslam ümməti Tövrat və İncili həmişəlik "mənsux" (hökmü ləğv edilmiş) sayırlar Allah belə bir məntiqsiz kəlamın islam ümmətinin ağzından çıxmasından qorusun. Qurani-Şərifin təsdiq etdiyi kitabları "mənsux" (hökmsüz) və etibarsız saymaq Quran əhlindən uzaq olan bir işdir. Qurani-Şərifin bəzi ehkamları onlara zahirən müxalif görünsə də, lakin həqiqətən, müxalif olmayıb, bəlkə, Tövrat və İncildə olan ehkamın həqiqəti Quranda bəyan olunubdur. Bu cümlədən, məsələn, qadınlar arasında ədalətlə rəftar etmək mümkün olmadığı üçün cənab İsa birdən artıq qadınla evlənməyi caiz görməyib. Lakin Qurani-Şərifdə bu mətləbin əsl həqiqəti bəyan olunub. Birdən artıq xanım almaqda ədalət şərti təyin edilibdir. Bəlkə ədalətsizlik qorxusu ilə birdən artıq xanım almaq haram sayılıbdır və bunun kimi Tövrat və İncilin digər ehkamlarını da Quranla müqayisə edəndə, hamısı bir-birinə müvafiq olur. Əgər desən ki, Tövrat və İncil təhrif olunub, necə ola bilər ki bunların ehkamı Qurana uyğun olsun? Cavab veririk: "Təhrifdən məqsəd ilahi ehkamı birdəfəlik ləğv edib onun əvəzinə əlahiddə hökmlər qoymaq deyildir. Bəlkə, məqsəd leş kimi iy verən dünyadan ötrü ilahi kitablarda qeyd edilən ehkamı xalqa bildirməyib, onun xilafını avam camaata deyib, onları cəlb etməkdir, bu mətləb fərq qoyulmadan biz Quran əhli ilə Tövrat və İncil əhlinin arasında bərabərdir". Əgər Qurani-Şərifin ehkamı təhrif olunmayıbsa, bəs islam ümməti arasında bu nə ixtilafdır? Yəhudi,*

قِيلَ ادْخُلِ الْجَنَّةَ ۖ قَالَ يَا لَيْتَ قَوْمِي يَعْلَمُونَ ﴿٢٦﴾ بِمَا غَفَرَ لِي رَبِّي وَجَعَلَنِي مِنَ الْمُكْرَمِينَ
﴿٢٧﴾ وَمَآ اَنْزَلْنَا عَلٰى قَوْمِهِ مِنْ بَعْدِهِ مِنْ جُنْدٍ مِنَ السَّمَآءِ وَمَا كُنَّا مُنْزِلِينَ ﴿٢٨﴾ اِنْ كَانَتْ اِلَّا
صَيْحَةً وَاحِدَةً فَاِذَا هُمْ خَامِدُونَ ﴿٢٩﴾يَا حَسْرَةً عَلَى الْعِبَادِ ۚ مَا يَأْتِيهِمْ مِنْ رَسُولٍ اِلَّا كَانُوا بِهِ
يَسْتَهْزِؤُنَ ﴿٣٠﴾

---

*xristian və müsəlmanlar arasında meydana gələn ixtilaf Allah-Təalanın kitabını təhrif etmək səbəbi ilə ortaya çıxıbdır və bu səbəbdən bir millətin müxtəlif qruplarının hər biri bir-birini təkzib edir, bəs Allah-Təalanın kitablarının hökmsüz, etibarsız olduğunu demək də yanlış bir işdir. Bir məqamda ki, Allah-Təala Quranın səhhətinə və uca peyğəmbərimiz Məhəmməd ibn Abdullahın doğruluğuna Tövrat və İncili dəlil saysın, necə demək olar ki, onlar hökmsüz və etibarsızdır və o hökmlər ki, Tövratda qeyd olunub, Quranda bəhs olunmayıb, gərək, Quran əhli də o hökmlərdə Tövrata bağlı olsunlar. Bəli, bəzi ehkamlarda fərq var, hər bir peyğəmbər öz zamanının şərtlərinə müvafiq bəzi ehkamları dəyişdirib, nəinki özündən əvvəlki ilahi kitabı birdəfəlik hökmsüz sayıb, etibardan salır, necə demək olar ki, Tövrat etibarsızdır. Halbuki Qurani-Şərifdə buyurur: "Bu Quran özündən əvvəl gələn Tövratı, İncili təsdiq edəndir". Bəs hansı Tövratı və İncili təsdiq edir? Tövrat, İncil, Quran, üçü də Allah-Təalanın kitablarıdır və onlarda olan hökmlər islam ümmətindən ötrü vacib əmrlərdir. Bu işi də diqqətlə düşünmək tövsiyə olunur).*

**26) (قِيلَ ادْخُلِ الْجَنَّةَ) - Elə ki o kişi qətlə yetirildi, Allah-Təala tərəfindən ona deyildi ki, cənnətə daxil ol.**

**27) (قَالَ يَا لَيْتَ قَوْمِي يَعْلَمُونَ بِمَا غَفَرَ لِي رَبِّي وَجَعَلَنِي مِنَ الْمُكْرَمِينَ) - Elə ki, qətl olunduqdan sonra Allah-Təalanın lütfü ilə cənnətə girdi, dedi: "Kaş ki, Allah-Təala məni bağışlayıb və məni əziz, möhtərəm etdiyini mənim xalqım bilib, küfr və müsibətdən tövbə edib, mənim kimi əbədi nemətlərə qovuşalar."** (Hekayə tamam oldu).

**28) (وَمَآ اَنْزَلْنَا عَلٰى قَوْمِهِ مِنْ بَعْدِهِ مِنْ جُنْدٍ مِنَ السَّمَآءِ وَمَا كُنَّا مُنْزِلِينَ)** - (Ey Məhəmməd), **o şəxsi həlak edəndən sonra onun xalqını həlak etmək üçün biz göydən qoşun göndərmədik və heç bir vaxt bir xalqı həlak etməkdən ötrü qoşun göndərmədik. Bəlkə, onları həlak etmək qoşun göndərməkdən asandır.**

**29) (اِنْ كَانَتْ اِلَّا صَيْحَةً وَاحِدَةً فَاِذَا هُمْ خَامِدُونَ)** - (Ey Məhəmməd), **onlara bizim əzab göndərməyimiz ancaq şiddətli bir səs idi ki, biz o səsi onların həlak olmasından ötrü yaratdıq. Elə ki o səs onların qulağına dəydi, ödləri partlayıb, kül olan qor kimi hamısının həyatı bir dəfədə məhv oldu.** (Allah-Təalanın peyğəmbərlərini təkzib edənlərin cəzası belə olar).

**30) (يَا حَسْرَةً عَلَى الْعِبَادِ ۚ مَا يَأْتِيهِمْ مِنْ رَسُولٍ اِلَّا كَانُوا بِهِ يَسْتَهْزِؤُنَ)** - (Ey Məhəmməd), **mənim bəndələrim təəssüf edilməyə layiqdirlər. Hər bir peyğəmbər ki,**

اَلَمْ يَرَوْا كَمْ اَهْلَكْنَا قَبْلَهُمْ مِنَ الْقُرُونِ اَنَّهُمْ اِلَيْهِمْ لَا يَرْجِعُونَ﴿٣١﴾ وَاِنْ كُلٌّ لَمَّا جَمِيعٌ لَدَيْنَا
مُحْضَرُونَ ﴿٣٢﴾ وَاٰيَةٌ لَهُمُ الْاَرْضُ الْمَيْتَةُ اَحْيَيْنَاهَا وَاَخْرَجْنَا مِنْهَا حَبًّا فَمِنْهُ يَاْكُلُونَ ﴿٣٣﴾
وَجَعَلْنَا فِيهَا جَنَّاتٍ مِنْ نَخِيلٍ وَاَعْنَابٍ وَفَجَّرْنَا فِيهَا مِنَ الْعُيُونِ ﴿٣٤﴾ لِيَاْكُلُوا مِنْ ثَمَرِهٖ وَمَا عَمِلَتْهُ
اَيْدِيهِمْ اَفَلَا يَشْكُرُونَ ﴿٣٥﴾ سُبْحَانَ الَّذِي خَلَقَ الْاَزْوَاجَ كُلَّهَا

---

**onlara gəldi, ona istehza etdilər. Buna görə də onlara əzab göndərildi, belə camaat peyğəmbərləri təkzib etdikləri üçün təəssüf edilməyə və əzab göndərilməyə layiqdirlər.**

**31) (اَلَمْ يَرَوْا كَمْ اَهْلَكْنَا قَبْلَهُمْ مِنَ الْقُرُونِ اَنَّهُمْ اِلَيْهِمْ لَا يَرْجِعُونَ) - Peyğəmbərlərə istehza edənlər bir çox camaatı onlardan əvvəl həlak etməmizdən agah olmayanlardır. Həqiqətən, onlar yenidən dünyada olanların yanına qayıdan deyildir. Əlbəttə, agah oldular, lakin qəflət yuxusu onların bəsirət gözlərini tutub, zəlalətdə qaldılar.**

**32) (وَاِنْ كُلٌّ لَمَّا جَمِيعٌ لَدَيْنَا مُحْضَرُونَ) -** (Ey Məhəmməd), **cəmi məxluqat qiyamət günündə bizim yanımızda hazır olub, məzlumun intiqamı zalımdan alınacaqdır.**

**33) (وَاٰيَةٌ لَهُمُ الْاَرْضُ الْمَيْتَةُ اَحْيَيْنَاهَا) -** (Ey Məhəmməd), **insan nəslindən ötrü ölüləri qiyamət günündə diriltməyə bizim qadir olduğumuza dəlil ölü olan yerdir ki, hər bir qisim ot-ələfi qurudub, fani olandan sonra yağış göndərib o yeri dirildərik və öləndən sonra həyat verərik. Rənglərin ən yaxşısı yaşıl rəngə çevriləndir. (وَاَخْرَجْنَا مِنْهَا حَبًّا فَمِنْهُ يَاْكُلُونَ) - O yerdən dənələr** (buğda, arpa, düyü, digər dənələr) **çıxardarıq ki, o dənələrdən yeyib yaşayarlar.**

**34) (وَجَعَلْنَا فِيهَا جَنَّاتٍ مِنْ نَخِيلٍ وَاَعْنَابٍ) - İnsan nəslindən ötrü yer üzündə xurmadan, üzümdən bağlar yaratdıq (وَفَجَّرْنَا فِيهَا مِنَ الْعُيُونِ) - və o yerdə çeşmələr açdıq, belə ki, onlardan faydalansınlar.**

**35) (لِيَاْكُلُوا مِنْ ثَمَرِهٖ وَمَا عَمِلَتْهُ اَيْدِيهِمْ) - O bağları insan nəslindən ötrü əmələ gətirdik ki, o bağların və əllərilə* zəhmət çəkib əkdikləri ağacların meyvəsindən yesinlər.**

*(***Qeyd:** "Hər bir meyvə Allah-Təalanın məxluqudur və onun iradəsi ilə yetişir, lakin insanların zəhməti və əməli onların hasil olmasına təsir etdiyi üçün o meyvələri həm özünə, həm də insanın əməlinə isnad etdi).*

**(اَفَلَا يَشْكُرُونَ) - Bəs Allah-Təalanın nemətlərinə şükür etməzlər? Belə nemətlərə kafir olub Allah-Təalaya şirk qoşmaq layiqdirmi?**

**36) (سُبْحَانَ الَّذِي خَلَقَ الْاَزْوَاجَ كُلَّهَا) - Eyib və nöqsandan uzaq və pakdır o Allah-Təala ki, hər bir cins və növbənöv məxluqu yaratdı.**

مِمَّا تُنْبِتُ الْاَرْضُ وَمِنْ اَنْفُسِهِمْ وَمِمَّا لَا يَعْلَمُونَ﴿٣٦﴾ وَاٰيَةٌ لَهُمُ الَّيْلُ ۚ نَسْلَخُ مِنْهُ النَّهَارَ فَاِذَا هُمْ مُظْلِمُونَ ۙ﴿٣٧﴾ وَالشَّمْسُ تَجْر۪ي لِمُسْتَقَرٍّ لَهَاۜ

---

**(مِمَّا تُنْبِتُ الْاَرْضُ وَمِنْ اَنْفُسِهِمْ وَمِمَّا لَا يَعْلَمُونَ) - O məxluqat ibarətdir yerdə göyərən şeylərdən və kişi və qadından ibarət olan insanlardan və o* məxluqlardan ki, onlara insan nəsli agah deyil.**

**37) (وَاٰيَةٌ لَهُمُ الَّيْلُ ۚ نَسْلَخُ مِنْهُ النَّهَارَ فَاِذَا هُمْ مُظْلِمُونَ) -** (Ey Məhəmməd), **bir də xalqdan ötrü bizim qüdrətimizin dəlili gecədir. Hansı ki, gündüzü ondan çəkib çıxardırıq, qəflətən onlar qaranlıqda qalırlar.**

**38) (وَالشَّمْسُ تَجْر۪ي لِمُسْتَقَرٍّ لَهَاۜ) -** (Ey Məhəmməd), **günəşin təbiəti bizim qüdrətimizə böyük dəlildir, günəş də öz təyin edilən yerində həmişə hərəkət etməkdədir.**

*(*__Qeyd:__ "Dənizlərdə və çöllərdə Allah-Təalanın məxluqatı insan nəslindən daha çoxdur. İnsan öz fövqəladə zəhməti ilə onlardan nə qədər çox kəşf etsə də, (Necə ki, bizim bu zamanda zooloqlar o işlə məşğul olurlar) yenə onların yüz mində birinin həqiqətinə yetişə bilməzlər. Lakin bu qədər çox heyvanın leşləri səhra və biyabanlarda, heç bir yerdə müşahidə olunmur. İmam Cəfər ibn Məhəmməd Sadiqdən rəvayət olunubdur ki, buyurur: "Heyvanat insan nəslindən bir dərəcə çoxdur. Amma onların cəsədlərinin heç bir yerdə müşahidə olunmamasının səbəbi odur ki, Allah-Təala onlara şüur veribdir. Elə ki, ölüm onlara gəldi, özlərini mağaralara, insanlardan kənar olan yerlərə çəkib orada ölərlər ki, günün altında qalmasınlar. Çünki günəşin şiddətli istisindən onların bədəni çürüyüb iylənər, hava da üfunət iyi verər. Havanın üfunətindən bəzi öldürücü xəstəliklər (məsələn, vəba) meydana gələr. Heyif olsun, islam ümməti maarifdən nə qədər aralanıblar. Belə müqəddəs kəlamları gizlində saxlayıb, əsilsiz, yalan sözlərə bağlanıb, onları özlərinə din və ayin seçirlər. Bir yerdə pis bəla (vəba xəstəliyi) vaqe olanda müsəlmanlara nəsihət və vəz edib, müqəddəs şəriətin sahibi və onun xəlifələri olan imamların sözünə uyğun olaraq təmizliyi, paklığı əmr edib, üfunət kimi şeylərdən çəkinməyi əmr etmək əvəzinə, islam dininin həqiqətlərindən bixəbər, cahil və nadan olduqları üçün hər bir şeyi qəza və qədərə həvalə edib deyirlər: "Hər vaxt insanın əcəli gəlsə, o vaxt öləcəkdir. Bu şeylərin heç biri fayda verən deyil". Belə nadanlığın çarəsi nədir? İslam ümmətinin məktəblərində oxunan "Nuş-afərin", "Çihil-tuti", "Gorbe-muş" kimi kitablarının yerinə insan nəslinin dünya və axirət işlərinə dair bu kimi uca sözlər hər bir dilə tərcümə olunub, uşaqlara öyrədilsə, hər halda elmləri artıb, kamil bir insan olarlar, nəinki avam qalarlar. Bəlkə də özlərini alim adlandıran şəxslər də bu kimi şeylərdən bixəbərdirlər, belə xəbərləri onlara oxuyanda sanki ağızlarına öldürücü zəhər tökürsən, ondan qaçıb, ovçunun ovdan ötrü dən töküb hiylə*

*qurması kimi ov axtararlar. Bu zamanda islam ümmətinin rəislərinə bütün müsəlmanları ayıq-sayıq edib, onları cəhalət və zəlalətdən xilas etmək lazımdır ki, Quranı özlərinə rəhbər seçib, xəbərin doğrusunu, saxtasını tanıyan şəxslərə tabe olub, ovçuların yol üstündə səpdikləri dənlərdən çəkinsinlər. Bir belə əziz kəlam (Qurani-Şərif) islam ümməti arasında olan halda nə vaxta kimi müsəlmanlar zəlalət və cəhalət vadisində sərgərdan və çaşqın qalacaqlar? Hər şeydən əvvəl ruhanilərin rəhbərlərini başa salmaq lazımdır.*

**(وَمَا عَلَيْنَا إِلَّا الْبَلَاغُ الْمُبِينُ) – Bizim vəzifəmiz yalnız** *(Allahın hökmlərini, peyğəmbərliyi) açıq-aşkar təbliğ etməkdir! "Bir neçə məsələni sual verirəm, hər şeyə şəkk ilə baxan fəqihlər cavab versinlər."*

*Bir keçinin arxasından nəcis sıçradı,*
*Ondan bir hörmüzlü kişinin gözü kor oldu.*
*Onun diyəsi keçinin sahibinin üzərindədir?*
*Yoxsa Hörmüz qazısındadır.*
*Heyz qanı əgər qadının qulağından gəlsə,*
*Onun hökmü nədir, ey Əbülhəsən?*
*Elm əgər budursa, burax onu, çıx get.*
*Yüz dəvə bu elmdən mənim üçün iki arpa dəyərindədir.*

*Hər şeyə şəkk ilə baxan fəqihlərin əksəriyyəti belə boş şeylərlə məşğul olduqları üçün bu alicənab onlardan ötrü bu şeirlərində bəhs olunan belə şeyləri nümunə verir. Bu zamanda müsəlman kitablarının əksəriyyəti həqiqətə aid olmayıb, lazım olmayan məsələlərlə, boş şeylərlə doludur. Məsələn, "nəcasət"dən (nəcis) belə yazırlar. Nəcasət on qisimdir: "Sidik, insan nəcisi, bunları qeyd edəndən sonra - nəcasətin bir qismi də qandır, deyirlər. Ondan sonra qanın qisimlərini qeyd edib - bəzisi pak, bəzisi nəcisdir, deyirlər. Pak qana nümunə olaraq deyirlər ki, cənab Musa zamanında Nil çayının suyu qibtilərə qan oldu. O qan nəcis deyildir. İmam Hüseynin şəhid olduğu (aşura) günü Beytül-müqəddəsdə hansı daşın altını qazdılar, qan çıxdı. O qan nəcis deyildir. Qəzvin şəhərinin Zərabad adlı kəndində köhnə bir iri ağac vardır, o ağacdan aşura günü qan çıxar, o qan nəcis deyildir. Bu şəkildə belə məsələlərdən bəhs edib kitabı doldururlar, bir millət ki belə alim adlananlar onların yol göstərəni olsun, vay o millətin halına. Təəccüblü orasıdır ki, hələ də millətin əksəriyyəti belə məsələlərin çirkinliyini dərk etməyibdir. Yardım Allahdandır).*

**(ذَٰلِكَ تَقْدِيرُ الْعَزِيزِ الْعَلِيمِ) - Günəşin öz müəyyən yerində (təkbaşına) dönməsi məxluqata qalib və hər bir şeyə agah olan Allah-Təalanın təqdiridir.** (Təqdir edib ki, gərək belə hərəkət etsin). **Ayədə keçən (لِمُسْتَقَرٍّ) sözünə diqqət**

وَالْقَمَرَ قَدَّرْنَاهُ مَنَازِلَ حَتّٰى عَادَ كَالْعُرْجُونِ الْقَد۪يمِ ﴿٣٩﴾ لَا الشَّمْسُ يَنْبَغ۪ي لَهَٓا اَنْ تُدْرِكَ الْقَمَرَ
وَلَا الَّيْلُ سَابِقُ النَّهَارِ وَكُلٌّ ف۪ي فَلَكٍ يَسْبَحُونَ ﴿٤٠﴾ وَاٰيَةٌ لَهُمْ اَنَّا حَمَلْنَا ذُرِّيَّتَهُمْ فِي الْفُلْكِ
الْمَشْحُونِ ﴿٤١﴾ وَخَلَقْنَا لَهُمْ مِنْ مِثْلِه۪ مَا يَرْكَبُونَ ﴿٤٢﴾

---

**edəndə günəşin öz ətrafında dönüb, hərəkət etmədiyi aşkar olur. Təfəkkür etmək lazımdır).**

**39) (وَالْقَمَرَ قَدَّرْنَاهُ مَنَازِلَ حَتّٰى عَادَ كَالْعُرْجُونِ الْقَد۪يمِ) -** (Ey Məhəmməd), **ayın seyr etməsi üçün mənzillər təyin etdik. Elə ki o mənzilləri seyr edib tamamladı, ondan sonra qayıdır xurma ağacının budağı kimi nazik** (hansı ki, onun göyərməyindən bir il, ya da bir ildən çox keçib) **olar, ayın əvvəlində zahir və peyda olar.** (Ayın 28 mənzili vardır. Hər bir mənzilə bir kərə nazil olar. Elə ki ayın 28-i oldu, əgər ay tamam olsa, 2 gecə, əgər tamamlanmasa bir gecə örtülü qalar. Ayın bu örtülü halına "Məhaq" (ayın son gecəsi) deyilir, ayın mənzillərinin adları geniş şəkildə Yunis surəsinin 7-ci ayəsinin təfsirində bəhs olundu).

**40) ( لَا الشَّمْسُ يَنْبَغ۪ي لَهَٓا اَنْ تُدْرِكَ الْقَمَرَ ) - Bu ayə keçən ayənin dediyi kimi günəşin hərəkətinin inkarına işarə edir və onun bir il ərzində öz ətrafında dönməsindən bəhs edir. Ayənin mənası belədir:** (Ey Məhəmməd), **günəşdən ötrü layiq deyil ki, aya çatsın. Yəni günəşin əzəmət və nuraniliyinə görə ondan ötrü seyr və hərəkət etmək layiq deyildir. Bəlkə, ay və digər ulduzlar, gərək, hərəkət edib onun ətrafına dolanıb ondan nur əldə etsinlər. Qurani-Şərifin mənasını belə anlamaq lazımdır və bu səbəbdən günəşdən nur alan ulduzlara günəşin ailəsi deyilir. Ev hərəkətsiz, evdə xidmət edənlərsə, hərəkətli olarlar.**

**(وَلَا الَّيْلُ سَابِقُ النَّهَارِ) Və gecə gündüzü keçib, gecə gündüzün yerinə, gündüz gecənin yerinə keçməz, gecədə günəş, gündüzdə ay doğmaz, hər ikisi bir yerə cəm olan deyildir. (وَكُلٌّ ف۪ي فَلَكٍ يَسْبَحُونَ) - Bəlkə günəşlə ayın hər biri bir xüsusi dairədə suya dalan şəxs kimi sonsuz fəzaya dalıb, hərəkət edərlər.**

**41) (وَاٰيَةٌ لَهُمْ اَنَّا حَمَلْنَا ذُرِّيَّتَهُمْ فِي الْفُلْكِ الْمَشْحُونِ) -** (Ey Məhəmməd), **bir də xalqdan ötrü bizim qüdrətimizə işarə olan dəlil budur ki, atalar öz ciyər parçası olan övladlarını dəniz ticarətinə göndərəndə, həqiqətən, biz onları dolu gəmiyə yükləyib, mühafizə edib məqsədlərinə çatdırarıq.**

**42) (وَخَلَقْنَا لَهُمْ مِنْ مِثْلِه۪ مَا يَرْكَبُونَ) - Və onlardan ötrü quruda da gəmi kimi minmələrindən ötrü heyvanatı yaratdıq, onlara da minib məqsədlərinə tərəf gedirlər.**

وَاِنْ نَشَاْ نُغْرِقْهُمْ فَلَا صَرِيخَ لَهُمْ وَلَا هُمْ يُنْقَذُونَ ﴿٤٣﴾ اِلَّا رَحْمَةً مِنَّا وَمَتَاعًا اِلٰى حِينٍ ﴿٤٤﴾
وَاِذَا قِيلَ لَهُمُ اتَّقُوا مَا بَيْنَ اَيْدِيكُمْ وَمَا خَلْفَكُمْ لَعَلَّكُمْ تُرْحَمُونَ ﴿٤٥﴾ وَمَا تَأْتِيهِمْ مِنْ اٰيَةٍ مِنْ
اٰيَاتِ رَبِّهِمْ اِلَّا كَانُوا عَنْهَا مُعْرِضِينَ ﴿٤٦﴾ وَاِذَا قِيلَ لَهُمْ اَنْفِقُوا مِمَّا رَزَقَكُمُ اللّٰهُ قَالَ الَّذِينَ كَفَرُوا
لِلَّذِينَ اٰمَنُوٓا اَنُطْعِمُ مَنْ لَوْ يَشَٓاءُ اللّٰهُ اَطْعَمَهُ

---

**43) (وَاِنْ نَشَاْ نُغْرِقْهُمْ فَلَا صَرِيخَ لَهُمْ وَلَا هُمْ يُنْقَذُونَ) - Əgər istəsə, ataları övladlarının müsibətinə düçar edib, onları dənizdə qərq edərik. O vaxt nə onların fəryadına yetişən olar, nə də onlara ölümdən nicat verən olmaz.**

**44) (اِلَّا رَحْمَةً مِنَّا وَمَتَاعًا اِلٰى حِينٍ) - Əlbəttə, heç bir şəxs onları mühafizə edib ölümdən nicat verə bilməz. Ancaq bizim rəhmətimiz onları bürüyüb, onlardan ötrü təyin edilən müəyyən bir vaxta kimi həyatlarından ləzzət alarlar. Ondan sonra ölüm onlara gəlib, axirət aləminə nəql edilərlər.**

**45) (وَاِذَا قِيلَ لَهُمُ اتَّقُوا مَا بَيْنَ اَيْدِيكُمْ وَمَا خَلْفَكُمْ لَعَلَّكُمْ تُرْحَمُونَ) -** (Ey Məhəmməd), **o zaman ki kafir və müşriklərə deyilir, (sən deyirsən:) bundan əvvəl olan və bundan sonra olacaq günahlarınızdan ötrü Allah-Təaladan qorxub, keçmiş günahlardan tövbəli gəlin, günahları tərk edin ki, Allah-Təala rəhməti ilə sizi bağışlasın, baxıb görürsən (ey Məhəmməd), onlar üz döndərib, sənin sözünə fikir vermədilər.**

**46) (وَمَا تَأْتِيهِمْ مِنْ اٰيَةٍ مِنْ اٰيَاتِ رَبِّهِمْ اِلَّا كَانُوا عَنْهَا مُعْرِضِينَ) -** (Ey Məhəmməd), **onların işi həmişə haqdan uzaq olmaqdır. Rəbləri Allah-Təalanın dəlil və sübutlarından bir dəlil və sübut onlara gəldikdə, ondan üz döndərib iman etməzlər. Bəlkə, zəlalət və cəhalətdə qalıb həlak olarlar.** (Allahın Rəsulu Məkkədə müşriklərə sədəqə və ehsan verməyi əmr etdi. Onlar inkar etdilər. sıradakı ayə onların haqqında gəldi).

**47) (وَاِذَا قِيلَ لَهُمْ اَنْفِقُوا مِمَّا رَزَقَكُمُ اللّٰهُ) - O zaman ki müşriklərə deyildi, (sən dedin, ey Məhəmməd), Allah-Təalanın sizə verdiyi ruzilərdən sədəqə və ehsan verin. (قَالَ الَّذِينَ كَفَرُوا لِلَّذِينَ اٰمَنُوٓا اَنُطْعِمُ مَنْ لَوْ يَشَٓاءُ اللّٰهُ اَطْعَمَهُ) - Müşriklər möminlərin kasıbları haqqında dedilər : "Bəs* biz yemək verək o şəxslərə ki, əgər Allah-Təala istəsəydi, özü onlara yemək verərdi. İndi ki, Allah-Təala onları kasıb edib, özü onlara yemək vermir, biz nədən ötrü onlara yemək verək?**

*(*Qeyd: "Necə ki bizim zamanımızda varlıların əksəriyyətini xəsislik sifəti bürüyüb bu kəlamın eynisini deyirlər və halbuki özlərinə Quran əhli deyib, Quran oxuyurlar, qüdsi hədisin dediyi kimi - varlılar Allah-Təalanın vəkilidirlər. Amma onlar özlərini Allah-Təalanın vəkilliyindən çıxarıb, varisləri üçün xəzinələr cəm edirlər. Millətin övladlarına bir xeyir, mənfəət verməyib, əbədi lənətə düçar olurlar. Varisləri o mərhumun malını nəfslərinin istəyi yolun-*

.اِنْ اَنْتُمْ اِلَّا فٖي ضَلَالٍ مُبٖينٍ﴿٤٧﴾ وَيَقُولُونَ مَتٰى هٰذَا الْوَعْدُ اِنْ كُنْتُمْ صَادِقٖينَ ﴿٤٨﴾ مَا يَنْظُرُونَ
اِلَّا صَيْحَةً وَاحِدَةً تَأْخُذُهُمْ وَهُمْ يَخِصِّمُونَ ﴿٤٩﴾ فَلَا يَسْتَطٖيعُونَ تَوْصِيَةً وَلَٓا اِلٰٓى اَهْلِهِمْ يَرْجِعُونَ
﴿٥٠﴾ وَنُفِخَ فِي الصُّورِ فَاِذَا هُمْ مِنَ الْاَجْدَاثِ اِلٰى رَبِّهِمْ يَنْسِلُونَ ﴿٥١﴾ قَالُوا يَا وَيْلَنَا مَنْ بَعَثَنَا
مِنْ مَرْقَدِنَا هٰذَا مَا وَعَدَ الرَّحْمٰنُ وَصَدَقَ الْمُرْسَلُونَ ﴿٥٢﴾ اِنْ كَانَتْ اِلَّا صَيْحَةً وَاحِدَةً فَاِذَا هُمْ
جَمٖيعٌ لَدَيْنَا مُحْضَرُونَ ﴿٥٣﴾

---

*da sərf edib, hər bir xəbis əməllərə qurşanıb, o əməllərin günahının əzabını o gorbagor olanın ruhuna aid edirlər. Bundan artıq xəbislik və rəzillik olarmı? İslam ümmətinin varlıları Qurani-Şərifin uca məzmununa fikir verib, onun izlərini digər millətlərdə müşahidə edib, xəcalət çəkib, əməllərindən həya etmirlərmi?)*

(Xəbislər varlı olub, kasıbları yedirib, yardım etməyin fayda və dərəcəsini anlamayıb, kasıbın kasıb olmasını Allah-Təalanın istəyinə həvalə etdilər). (اِنْ اَنْتُمْ اِلَّا فٖي ضَلَالٍ مُبٖينٍ) - **Ey Məhəmmədə iman etməyənlər, siz aşkar olan zəlalətdəsiniz. O sizə sədəqə verməyi əmr edir, siz ona itaət etmirsiniz.**

**48)** (وَيَقُولُونَ مَتٰى هٰذَا الْوَعْدُ اِنْ كُنْتُمْ صَادِقٖينَ) - **Müşriklər möminlərə deyirlər ki, bu qiyaməti ki, vəd edirsiniz, əgər doğru deyənsinizsə, bəyan edin görək nə vaxt olacaqdır?**

**49)** (مَا يَنْظُرُونَ اِلَّا صَيْحَةً وَاحِدَةً تَأْخُذُهُمْ وَهُمْ يَخِصِّمُونَ) - (Ey Məhəmməd), **qiyaməti inkar edən müşriklər dünyada bir-biriləri ilə məişət və ticarət işləri üstündə düşmənçilik və qovğa edərkən qiyamətin vaqe olmağını bildirən** (sayhə) **şiddətli bir səsi gözləyirlər, o səs onları tutub onun şiddətindən hamısı həlak olub, qiyamət vaqe olar.**

**50)** (فَلَا يَسْتَطٖيعُونَ تَوْصِيَةً وَلَٓا اِلٰٓى اَهْلِهِمْ يَرْجِعُونَ) - **O səs onları tutanda nə bir şeyi vəsiyyət etməyə, nə də ailələrinə tərəf geri dönməyə qadir olmazlar. Bəlkə hər bir məkanda ki o səs onları tutdu, həmin məkanda həlak olarlar.**

**51)** (وَنُفِخَ فِي الصُّورِ) - **Hamısı o şiddətli səsin səbəbi ilə həlak olandan sonra Allah-Təala surətlərə ruh üfürüb hamısı dirilər.**

(فَاِذَا هُمْ مِنَ الْاَجْدَاثِ اِلٰى رَبِّهِمْ يَنْسِلُونَ) - **Diriləndən sonra qəbirlərdən durub öz rəbləri Allah-Təala tərəfinə sürətlə gedib məhşərdə cəm olarlar.**

**52)** (قَالُوا يَا وَيْلَنَا مَنْ بَعَثَنَا مِنْ مَرْقَدِنَا) - **Elə ki məxluqat dirilib, məhşərdə toplandılar, qiyaməti inkar edən müşriklər təəccüblə deyərlər: "Yazıq olsun bizə, qiyaməti inkar etdik, kim bizə həyat verib qəbirlərimizdən qaldırdı?** (هٰذَا مَا وَعَدَ الرَّحْمٰنُ وَصَدَقَ الْمُرْسَلُونَ) - **Rəhman olan Allah-Təalanın verdiyi vəd budur, vaqe oldu. Peyğəmbərlər doğru deyirmiş ki, belə bir gün olacaq. Biz o günü inkar edirdik, amma vaqe oldu".**

**53)** (اِنْ كَانَتْ اِلَّا صَيْحَةً وَاحِدَةً فَاِذَا هُمْ جَمٖيعٌ لَدَيْنَا مُحْضَرُونَ) - (Ey Məhəmməd), **onların dirilməsi ancaq bir** (sayhə) **səs səbəbi ilə oldu ki, bütün surətlərə**

فَالْيَوْمَ لَا تُظْلَمُ نَفْسٌ شَيْـًٔا وَلَا تُجْزَوْنَ اِلَّا مَا كُنْتُمْ تَعْمَلُونَ ﴿٥٤﴾ اِنَّ اَصْحَابَ الْجَنَّةِ الْيَوْمَ فِي شُغُلٍ فَاكِهُونَ ﴿٥٥﴾ هُمْ وَاَزْوَاجُهُمْ فِي ظِلَالٍ عَلَى الْاَرَآئِكِ مُتَّكِؤُنَ ﴿٥٦﴾ لَهُمْ فِيهَا فَاكِهَةٌ وَلَهُمْ مَا يَدَّعُونَ ﴿٥٧﴾ سَلَامٌ قَوْلًا مِنْ رَبٍّ رَحِيمٍ ﴿٥٨﴾ وَامْتَازُوا الْيَوْمَ اَيُّهَا الْمُجْرِمُونَ ﴿٥٩﴾ اَلَمْ اَعْهَدْ اِلَيْكُمْ يَا بَنِيٓ اٰدَمَ اَنْ لَا تَعْبُدُوا الشَّيْطَانَ اِنَّهُ لَكُمْ عَدُوٌّ مُبِينٌ ﴿٦٠﴾

---

**o səsin səbəbi ilə ruh daxil olub, dirilib bizim tərəfimizə haqq-hesabdan ötrü gələrlər.**

**54) (فَالْيَوْمَ لَا تُظْلَمُ نَفْسٌ شَيْـًٔا) -** (Ey Məhəmməd), **qiyamət günündə məhşər əhlinə deyilər: “Bugünkü gündə heç bir nəfsə zülm olunmaz. (وَلَا تُجْزَوْنَ اِلَّا مَا كُنْتُمْ تَعْمَلُونَ) Bugünkü gündə sizə dünyada etdiyiniz əməllərin qarşılığından başqa bir cəza verilməz.**

**55) (اِنَّ اَصْحَابَ الْجَنَّةِ الْيَوْمَ فِي شُغُلٍ فَاكِهُونَ) - Həqiqətən, bugünkü gündə cənnətə daxil olanlar vəsfə gəlməyən işlərlə məşğul olub, ləzzət alarlar.**

**56) (هُمْ وَاَزْوَاجُهُمْ فِي ظِلَالٍ عَلَى الْاَرَآئِكِ مُتَّكِؤُنَ) - Cənnət əhli özləri və xanımları kölgələr altında taxtlara söykənib istirahət edərlər.** (Hərçənd cənnətdə isti və soyuq olmaz, lakin dünyada hər hansı bir istirahətdənsə isti gündə ağacların kölgəsində istirahət etmək üstün olduğu üçün cənnət istirahəti kölgə istirahətinə bənzədildi).

**57) (لَهُمْ فِيهَا فَاكِهَةٌ وَلَهُمْ مَا يَدَّعُونَ) - Cənnət əhlindən ötrü cənnətdə hər bir qisim meyvələr və arzu etdikləri hər bir şey onlardan ötrü mövcuddur.** (Allah-Təala özünəməxsus olan yaradıcılıq sifəti ilə cənnət əhlinə lütf bəxş edir. Elə ki, nəfsləri bir şey xahiş etdi, o şey o anda mövcud olar).

**58) (سَلَامٌ قَوْلًا مِنْ رَبٍّ رَحِيمٍ) - Rəhmət sahibi olan Allah-Təala onlara salam göndərib, onlara deyilər ki, Allah-Təaladan sizə salam olsun. (Allah-Təalanın cənnət əhlinə salam göndərmək xüsusunda Əşəri məzhəbi Allah-Təalanın görünməsinə işarə edən elə hədislər nəql ediblər ki, insana təəccüblü gəlir. Həqiqətən, təqlid insanı həlak etdirər. Hər şəxs o hədislərə agah olmağı istəsə, Əşəri məzhəbi alimlərinin təfsirlərinə müraciət etsin, xüsusən Fazil Bəğunin təfsirinə).**

**59) (وَامْتَازُوا الْيَوْمَ اَيُّهَا الْمُجْرِمُونَ) - Qiyamət günündə Allah-Təala günahkarlara xitab edib buyurur: “Ey günahkarlar, bugünkü gündə möminlərdən aralanıb kənar olun. Onlar cənnət əhlidir. Siz onlara qarışa bilməzsiniz”.**

**60) (اَلَمْ اَعْهَدْ اِلَيْكُمْ يَا بَنِيٓ اٰدَمَ اَنْ لَا تَعْبُدُوا الشَّيْطَانَ اِنَّهُ لَكُمْ عَدُوٌّ مُبِينٌ) -** (Ondan sonra qiyamət günündə Adəm övladına xitab edib buyurar: **“Ey Adəm övladı, bəs mən sizə əhd** (vəsiyyət) **etmədimmi ki, şeytana** (şəri əmr edən nəfsə) **ibadət və itaət etməyin, həqiqətən, şeytan sizə zahir və aşkar olan düşməndir.**

وَاَنِ اعْبُدُونِيۜ هٰذَا صِرَاطٌ مُسْتَقِيمٌ﴿٦١﴾ وَلَقَدْ اَضَلَّ مِنْكُمْ جِبِلًّا كَثِيرًاۜ اَفَلَمْ تَكُونُوا تَعْقِلُونَ﴿٦٢﴾
هٰذِهِ جَهَنَّمُ الَّتِي كُنْتُمْ تُوعَدُونَ﴿٦٣﴾ اِصْلَوْهَا الْيَوْمَ بِمَا كُنْتُمْ تَكْفُرُونَ﴿٦٤﴾ اَلْيَوْمَ نَخْتِمُ عَلٰٓى
اَفْوَاهِهِمْ وَتُكَلِّمُنَآ اَيْدِيهِمْ وَتَشْهَدُ اَرْجُلُهُمْ بِمَا كَانُوا يَكْسِبُونَ ﴿٦٥﴾ وَلَوْ نَشَآءُ لَطَمَسْنَا عَلٰٓى اَعْيُنِهِمْ
فَاسْتَبَقُوا الصِّرَاطَ فَاَنّٰى يُبْصِرُونَ ﴿٦٦﴾

---

(Allah-Təalanın əhdi (vəsiyyəti) insanın ağlına yerləşdirilən dəlillər və peyğəmbərlər vasitəsiylə göndərilən hökmlərdən ibarətdir).

**61) (وَاَنِ اعْبُدُونِيۜ هٰذَا صِرَاطٌ مُسْتَقِيمٌ) - Şeytana ibadəti tərk edib mənə ibadət edin. Mənə ibadət edib şeytana ibadəti tərk edin. Düz və haqqa götürən o yoldur ki, insana nicat verir. Amma siz Adəm övladı, mənə itaət etməyib, mənə ibadət etməyi tərk edib, şeytana ibadət etdiniz.**

**62) (وَلَقَدْ اَضَلَّ مِنْكُمْ جِبِلًّا كَثِيرًاۜ اَفَلَمْ تَكُونُوا تَعْقِلُونَ) -Məbud gərək ona ibadət edəni hidayət etsin. Amma sizin məbudunuz olan şeytan həqiqətən sizlərdən çoxunu zəlalətə salıb hidayətdən kənar etdi. Mən sizə ağıl vermişdim. Gərək, ağıldan faydalanaydım. Nədən ötrü ağlınızla hərəkət etməyib, mənim ibadətimi tərk edib, şeytana ibadət edib, həmişəlik məhv olmağa düçar oldunuz.**

**63) (هٰذِهِ جَهَنَّمُ الَّتِي كُنْتُمْ تُوعَدُونَ) - Bu cəhənnəmi ki, görürsünüz, həmin cəhənnəmdir ki, dünyada sizə mənim peyğəmbərlərim mənim tərəfimdən vəd edirdilər. Amma siz onu inkar edirdiniz.**

**64) (اِصْلَوْهَا الْيَوْمَ بِمَا كُنْتُمْ تَكْفُرُونَ) - O səbəbə görə ki, dünyada mənim tərəfimdən göndərilən peyğəmbərlərə itaət etməyib mənə kafir oldunuz, bugünkü gündə bu cəhənnəmə daxil olun və orada həmişəlik əzaba düçar olacaqsınız.**

**65) (اَلْيَوْمَ نَخْتِمُ عَلٰٓى اَفْوَاهِهِمْ وَتُكَلِّمُنَآ اَيْدِيهِمْ) -** (Ey Məhəmməd), **ogünkü gündə onların ağızlarına möhür vurub, danışmaqdan onlara mane olarıq. Lakin əlləri bizimlə danışıb, etdikləri günah əməlləri təsdiq edər. (وَتَشْهَدُ اَرْجُلُهُمْ بِمَا كَانُوا يَكْسِبُونَ) Onların ayaqları da hər bir günah əməl ki, ediblər, onlara şəhadət edərlər.** (Elə ki, kafir və müşriklərin bədən orqanları onların əməllərinə şəhadət verdi, hamısı çaşqın qalıb, təəccüb edərlər).

**66) (وَلَوْ نَشَآءُ لَطَمَسْنَا عَلٰٓى اَعْيُنِهِمْ فَاسْتَبَقُوا الصِّرَاطَ فَاَنّٰى يُبْصِرُونَ) -** (Ey Məhəmməd), **əgər biz istəsək, bizə kafir olan şəxslərin gözlərini elə kor edərik ki, əsla onlarda göz əlaməti qalmaz, o vaxt həmişə adət etdikləri yolla gedib dünya işlərini və məişətlərini idarə etməyə qadir olmazlar. Gözlərini kor etdiyimiz halda necə ola bilər ki, qadir olsunlar.** (Lakin onlara mərhəmət edib, kor etməyib, əzablarını qiyamətə qədər təxirə saldıq).

وَلَوْ نَشَآءُ لَمَسَخْنَاهُمْ عَلٰى مَكَانَتِهِمْ فَمَا اسْتَطَاعُوا مُضِيًّا وَلَا يَرْجِعُونَ ﴿٦٧﴾ وَمَنْ نُعَمِّرْهُ نُنَكِّسْهُ
فِي الْخَلْقِ اَفَلَا يَعْقِلُونَ ﴿٦٨﴾ وَمَا عَلَّمْنَاهُ الشِّعْرَ وَمَا يَنْبَغِي لَهُ اِنْ هُوَ اِلَّا ذِكْرٌ وَقُرْاٰنٌ مُبِينٌ ﴿٦٩﴾
لِيُنْذِرَ مَنْ كَانَ حَيًّا وَيَحِقَّ الْقَوْلُ عَلَى الْكَافِرِينَ ﴿٧٠﴾ اَوَلَمْ يَرَوْا اَنَّا خَلَقْنَا لَهُمْ مِمَّا عَمِلَتْ اَيْدِينَآ
اَنْعَامًا فَهُمْ لَهَا مَالِكُونَ ﴿٧١﴾ وَذَلَّلْنَاهَا لَهُمْ فَمِنْهَا رَكُوبُهُمْ وَمِنْهَا يَاْكُلُونَ ﴿٧٢﴾

---

67) (وَلَوْ نَشَآءُ لَمَسَخْنَاهُمْ عَلٰى مَكَانَتِهِمْ) - (Ey Məhəmməd), **əgər yenə istəsək, bizə kafir olanları olduqları məkan və evlərində surətlərini dəyişdirib, çirkinləşdirərik, qurudarıq, cansız kimi düşüb qalarlar.**

(فَمَا اسْتَطَاعُوا مُضِيًّا وَلَا يَرْجِعُونَ) - **O vaxt yerlərindən hərəkət edib, nə bir tərəfə getməyə, nə də qayıtmağa qüdrətləri olmaz.** (Lakin mərhəmət edib bədənlərinə səhhət vermişik. Hər bir işlərini idarə etməyə qadirdirlər. Bu nemətlərə şükür etməyib, kafir oldular. Biz də onların əzabını qiyamətə qədər təxirə saldıq).

68) (وَمَنْ نُعَمِّرْهُ نُنَكِّسْهُ فِي الْخَلْقِ اَفَلَا يَعْقِلُونَ) - (Ey Məhəmməd), **bəs baxıb görmürlər ki, hər bir şəxsə ki, dünyada ömür versək, əvvəl uşaqlıqdan etibarən tədricən onun ağıl-kamalını, şüur və fərasətini, elm və hünərini, qüvvət və qüdrətini artırarıq, elə ki qocaldı, yenə onun təbiətini geriyə çevirib, ona bəxş etdiyimiz şeylərin hamısını ondan alıb uşaqlıq halına qaytarırıq, güclü olandan sonra zəif, ağıllı olandan sonra nadan, alim olandan sonra cahil olar. Amma xalq ağılla hərəkət etmir ki, ibrət alıb bizim qüdrətimizdən agah olsun.** (Məkkə əhli olan Qüreyş camaatından Uqbə ibn Əbu Muit və ondan başqaları) **Quranın şeir olduğunu deyirdilər, Allahın Rəsuluna şairlik isnad edib Qurana şeir dedilər. Allah-Təala sıradakı ayəni onun rəddi üçün göndərdi).**

69) (وَمَا عَلَّمْنَاهُ الشِّعْرَ وَمَا يَنْبَغِي لَهُ اِنْ هُوَ اِلَّا ذِكْرٌ وَقُرْاٰنٌ مُبِينٌ) - **Biz bu peyğəmbərə** (Məhəmmədə) **şeir deməyi təlim etməmişik və şeir demək də ona layiq deyildir. Bəlkə sizə oxunan kəlamlar, ayələr Allah-Təaladan xalqa öyüd-nəsihət və aşkar olan Qurandır. Qurana şeir demək insafsızlıqdır.**

70) (لِيُنْذِرَ مَنْ كَانَ حَيًّا وَيَحِقَّ الْقَوْلُ عَلَى الْكَافِرِينَ) - **Quranı** (Məhəmmədə) **verdik ki, bu Quranın səbəbinə diri və ağıllı, təfəkkür edən şəxsləri pisliklərdən çəkindirsin. Kafirlər meyit dərəcəsində olduqları üçün onlara xəbərdarlıq fayda verməyib, onlara əzab gəlməsi layiq və münasib olar. Gərək onlara əzab olunsun.**

71) (اَوَلَمْ يَرَوْا اَنَّا خَلَقْنَا لَهُمْ مِمَّا عَمِلَتْ اَيْدِينَآ اَنْعَامًا فَهُمْ لَهَا مَالِكُونَ) - (Ey Məhəmməd), **bəs bu məxluqat baxıb görmürlər ki, həqiqətən, o şeyləri ki, biz öz kamil qüdrətimizlə heç kimdən kömək istəməyib, yalnız özümüz yaratmışıq, bunlar fayda verən o şeylərdir ki, (dəvə, öküz, qoyun, keçi) onlar o heyvanlara malik olub faydalanırlar.**

72) (وَذَلَّلْنَاهَا لَهُمْ) - **O heyvanları insandan ötrü zəlil etmişik, hər bir şəkildə onları idarə etməyə qadirdirlər.** (فَمِنْهَا رَكُوبُهُمْ وَمِنْهَا يَاْكُلُونَ) **- O heyvan-**

وَلَهُمْ فِيهَا مَنَافِعُ وَمَشَارِبُ ۖ اَفَلَا يَشْكُرُونَ ﴿٧٣﴾ وَاتَّخَذُوا مِنْ دُونِ اللّٰهِ اٰلِهَةً لَعَلَّهُمْ يُنْصَرُونَ ۖ
﴿٧٤﴾ لَا يَسْتَطِيعُونَ نَصْرَهُمْ ۙ وَهُمْ لَهُمْ جُنْدٌ مُحْضَرُونَ ﴿٧٥﴾ فَلَا يَحْزُنْكَ قَوْلُهُمْ ۘ اِنَّا نَعْلَمُ مَا
يُسِرُّونَ وَمَا يُعْلِنُونَ ﴿٧٦﴾

---

**ları insandan ötrü elə zəlil etmişik ki, həm onları ehtiyac zamanı minib, istədikləri tərəfə gedərlər** (dəvə və öküz kimi) **həm onlardan yemək hazırlayıb yeyərlər, o vəhşi heyvanları onlardan ötrü bu şəkildə zəlil etdik. Bununla birlikdə yenə, tövhid və qüdrətimizə tabe olmurlar.**

**73)** (وَلَهُمْ فِيهَا مَنَافِعُ وَمَشَارِبُ ۖ اَفَلَا يَشْكُرُونَ) **- İnsan nəslindən ötrü o heyvanların cildlərində, boyunlarında, ətlərində, bəzisinə minməkdə mənfəət və içmək üçün dadlı süd vardır. Bəs belə nemətlərə şükür etməzlərmi? Əlbəttə, gərək, şükür etsinlər. Amma insan öz nəfsinə zülm edib Allah-Təalanın nemətlərinə qarşı nankorluq edirlər.**

**74)** (وَاتَّخَذُوا مِنْ دُونِ اللّٰهِ اٰلِهَةً لَعَلَّهُمْ يُنْصَرُونَ) **- Zülmün ən yüksək dərəcəsinə çatıb Allah-Təalaya şirk qoşub, özlərinə ondan başqa məbudlar seçirlər ki, bəlkə onlara kömək olub Allah-Təalanın əzabından onları* xilas etsinlər.** (Necə ki, bütpərəstlər deyirdilər: “Bu bütlər Allah-Təalanın yanında bizə şəfaət edəcəklər”).

*(***Qeyd:** *“Bütpərəstlər özlərindən ötrü ağacdan, daşdan və digər şeylərdən bütlər düzəltmişdilər. Bəs ağıllı şəxs o şeylərə ibadət edib, onları özündən ötrü Allah-Təalanın yanında şəfaətçi sayarmı? Onlar, əslində, o şeyləri şəfaətçi saymayıb, onlara ibadət etmirdilər, bəlkə o bütləri peyğəmbər və məlaikənin surəti sayıb, onlara ibadət edirdilər və o surətlərin sahiblərini, məsələn, İbrahim Xəlilullahı və oğlu İsmayılı (ə.s) və mələkləri özlərinə şəfaətçi sayıb, onları axirətdə yardım etmələrindən ötrü istəyib, onların vasitəsilə Allah-Təalanın əzabından xilas olmağı ümid edirdilər. Bununla belə Allah-Təala ayədə onları təkzib edib, xahiş və ümidlərinin puç olduğunu buyurdular. Həmin ayənin bəlağətli məzmununu düşünəndə islam ümmətinin əksəriyyətinin müşrik olub ayənin əhatə dairəsinə daxil olduğu görünür. Necə ki onlar cənab İbrahim və İsmayılı və digər peyğəmbərləri özlərinə şəfaətçi, köməkçi saydılar, habelə islam ümmətinin hər bir camaatı öz məzhəb rəislərini, bəlkə özlərinin düzəltdiyi övliyaları və onların məzarlarını və torpaqlarını özlərinə yardım edən və şəfaətçi sayıb Allah-Təalanı unudublar. Ayə o bütpərəstlərə aid olduğu kimi, heç bir fərq olmadan bu bütpərəstlərə də aiddir.)*

**75)** (لَا يَسْتَطِيعُونَ نَصْرَهُمْ ۙ وَهُمْ لَهُمْ جُنْدٌ مُحْضَرُونَ) **- O məbudlar** (bütlər) **onlara kömək olub qiyamət günündə onları ilahi əzabdan xilas etməyə qadir olmazlar, halbuki bu dünyada onlar bütlərdən ötrü qoşundurlar, onların xidmətində olub, onlara yetişən afəti dəf etməyə hazırdırlar.**

**76)** (فَلَا يَحْزُنْكَ قَوْلُهُمْ ۘ اِنَّا نَعْلَمُ مَا يُسِرُّونَ وَمَا يُعْلِنُونَ) **-** (Ey Məhəmməd), **Məkkə əhli olan müşriklərin səni təkzib etməsi səni məhzun və qəmgin etməsin. Onların sözlərinə etina etmə, həqiqətən, biz onların sənə qarşı olan gizli və aşkar ədavətlərindən agahıq və onlara cəza verərik. Sən onların işini bizə**

اَوَلَمْ يَرَ الْاِنْسَانُ اَنَّا خَلَقْنَاهُ مِنْ نُطْفَةٍ فَاِذَا هُوَ خَصِيمٌ مُبِينٌ ﴿٧٧﴾ وَضَرَبَ لَنَا مَثَلًا وَنَسِيَ خَلْقَهُ ۜ قَالَ مَنْ يُحْيِ الْعِظَامَ وَهِيَ رَمِيمٌ ﴿٧٨﴾ قُلْ يُحْيِيهَا الَّذِيٓ اَنْشَاَهَآ اَوَّلَ مَرَّةٍ ۜ وَهُوَ بِكُلِّ خَلْقٍ عَلِيمٌ ۙ﴿٧٩﴾ اَلَّذِي جَعَلَ لَكُمْ مِنَ الشَّجَرِ الْاَخْضَرِ نَارًا فَاِذَآ اَنْتُمْ مِنْهُ تُوقِدُونَ ﴿٨٠﴾ اَوَلَيْسَ الَّذِي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ بِقَادِرٍ عَلٰىٓ اَنْ يَخْلُقَ مِثْلَهُمْ ۜ بَلٰى وَهُوَ الْخَلَّاقُ الْعَلِيمُ﴿٨١﴾

---

**həvalə edib peyğəmbərliyi təbliğ etməkdə möhkəm və sabit ol. (Məkkə əhlindən qiyaməti inkar edən şəxslərdən bir qrup, o cümlədən onlardan** (Übey ibn Xələf, Əbu Cəhl, As ibn Vail, Vəlid ibn Müğirə) **bir-birlərilə Allahın Rəsulu haqqında danışıb Übey ibn Xələf dedi: "Baxıb görmürsünüz ki, Məhəmməd nə deyir: - Allah-Təala onları yenidən dirildəcəkdir", -deyir, and olsun Allah-Təalaya mən onun yanına gedib bu barədə onunla mübahisə edəcəyəm. Bu sözü deyib bir köhnə sümük götürüb Allahın Rəsulunun yanına getdi. O sümüyü əlində tutub dedi: "EyMəhəmməd, sən deyirsən ki, Allah-Təala bu sümüyü çürüyüb yox olandan sonra həyat verib dirildəcəkdir. Allahın Rəsulu buyurdu: "Bəli, Allah-Təala sənə həyat verib cəhənnəmə daxil edəcəkdir. Bu barədə növbəti ayə göndərildi.**

**77)** (اَوَلَمْ يَرَ الْاِنْسَانُ اَنَّا خَلَقْنَاهُ مِنْ نُطْفَةٍ فَاِذَا هُوَ خَصِيمٌ مُبِينٌ) - (Ey Məhəmməd), **bunlar ki, qiyaməti inkar edir, bəs inkar edən insan özünün əsl təbiətinə baxıb fikir vermir ki, əslində, biz onu sidiyin çıxdığı yerdən çıxan spermadan yaratmışıq? Murdarlıq halından keçib ağıl-kamal sahibi bir kişi olub, indi gəlib bizimlə düşmənçilik və savaş edib, qüdrətimizi inkar edir.**

**78)** (وَضَرَبَ لَنَا مَثَلًا وَنَسِيَ خَلْقَهُ ۜ قَالَ مَنْ يُحْيِ الْعِظَامَ وَهِيَ رَمِيمٌ) - **İnsan öz yaradılışını unudub, bizim qüdrətimizi inkar edib, bizdən ötrü məsəl gətirib deyir ki, bu çürüyən sümüklərə həyat verən kimdir, çürüyən sümüklərə də həyat vermək olarmı?**

**79)** (قُلْ يُحْيِيهَا الَّذِيٓ اَنْشَاَهَآ اَوَّلَ مَرَّةٍ) - (Ey Məhəmməd), **onların cavabında de ki, o sümükləri başlanğıcda yaradan Allah-Təala yenidən dirildər.** (وَهُوَ بِكُلِّ خَلْقٍ عَلِيمٌ) **Hər bir məxluqun yaradılması ki, hansı hikmətlə o, yaradılmalıdır, onların hamısından Allah-Təala agahdır.**

**80)** (اَلَّذِي جَعَلَ لَكُمْ مِنَ الشَّجَرِ الْاَخْضَرِ نَارًا فَاِذَآ اَنْتُمْ مِنْهُ تُوقِدُونَ) - **Allah-Təala elə qüdrət sahibidir ki sizdən ötrü təptəzə yaşıl ağacdan od çıxardıb verib ki, o yaş ağacın oduyla qızınıb özünüzdən soyuğu dəf edəsiniz. Yaş ağacdan od çıxarmaqdan çox qüdrət olarmı? "Mərx və afar" Ərəbistanda iki ağacdır, birincisinə erkək, ikincisinə dişi deyilir. Onlardan iki nazik budaq qıranda onların qabığı soyulur, o iki budağı bir-birinə sürtüb ondan od hasil edirlər. Onunla ehtiyaclarını həll edirlər).**

**81)** (اَوَلَيْسَ الَّذِي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ بِقَادِرٍ عَلٰىٓ اَنْ يَخْلُقَ مِثْلَهُمْ) - (Ey Məhəmməd), **müşriklərə de ki, o Allah-Təala ki, göyləri və yeri yaradıb, bəs o, insan kimi kiçik və zəif məxluqu yaratmağa qadir deyilmi?** (بَلٰى وَهُوَ الْخَلَّاقُ الْعَلِيمُ)

إِنَّمَآ اَمْرُهُ إِذَآ اَرَادَ شَيْـًٔا اَنْ يَقُولَ لَهُ كُنْ فَيَكُونُ ﴿٨٢﴾ فَسُبْحَانَ الَّذِي بِيَدِهِ مَلَكُوتُ كُلِّ شَيْءٍ وَاِلَيْهِ تُرْجَعُونَ ﴿٨٣﴾

---

**- Əlbəttə, qadirdir. Bu qədər çox məxluqu yaradıb, hər bir şeyə agah olan ancaq Allah-Təaladır. Ondan başqası heç bir şeyə qadir və alim deyildir.**

**82) (**إِنَّمَآ اَمْرُهُ إِذَآ اَرَادَ شَيْـًٔا اَنْ يَقُولَ لَهُ كُنْ فَيَكُونُ**) -Ey Muhamməd! Həqiqətəndə, Allahın şanı və əmri ilə bu olandır. Onun iradəsi və hikməti bir şeyin yaranması və bir şey buyurmasını istəyərsə ona “ol” deyər, o şey gecikməyərək dərhal meydana gələr.** (Allahın deməsi bizim düşünməmiz və təfəkkürümüz üçündür. Allahın bir şeyi xəlq etməsində demək, danışmaq yoxdur. Həmin iradeyi-əzəlisi ilə Allah bir şeyin olmasını diləyərsə o dərhal mövcud olar.)

**83) (**فَسُبْحَانَ الَّذِي بِيَدِهِ مَلَكُوتُ كُلِّ شَيْءٍ وَاِلَيْهِ تُرْجَعُونَ**) - Allah-Təala hər bir şeyə malik olub, onları idarə etməsi onun qüdrəti daxilindədir. Hər bir eyib və nöqsandan pak və qüsursuzdur və siz insanlar hamınız onun tərəfinə qayıdacaqsınız, o vaxt hər bir şəxsə öz əməlinin qarşılığını verəcəkdir.**

**Allaha həmd olsun, onun yardımı ilə Yasin surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurubdur:** *“Hər bir şeyin bir qəlbi vardır. Quranın qəlbi Yasindir”.* (İbn Kəsir, Təfsir., VI/547) **İbn Abbas deyir: “Yasin surəsinin fəziləti mövzusunda Allahın Rəsulundan nədən bu qədər hədisin varid olmasına mən agah deyildim. Ta ki, çox fikirləşəndən sonra məlum oldu ki, bu axırıncı ayəyə görə imiş. Yəni axırıncı ayə Allah-Təalanın kamil qüdrəti ilə külli mövcudatın hər bir işini və insan nəslini yenidən dirildib, onlara əməllərinin qarşılığını verməsinin isbatına aiddir və ayə bu mübarək surəyə aid olduğu üçün surənin fəziləti də çoxdur.** (Qazi Beyzavi, Ənvarut-Tənzil, V/224) **Allah-Təala bu mübarək surədə (necə ki bəhs olunacaq) müqəddəs şəxslərə and içir və and içməkdən məqsədi islam ümmətini o şəxslərə hörmət etməyə vadar edib, zəlalət və cəhalətdən xilas olmasıdır.**

**Buyurur ki, islam ümməti açıq-aydın ayələrə, gərək, diqqətlə baxıb ibrət alsınlar.**

## əs-SAFFAT SURƏSİ

31-ci surədir. Məkkədə nazil olub, 181 ayə, 860 kəlmə və 3826 hərfdir.

وَالصَّٓافَّاتِ صَفًّاۙ ﴿١﴾ فَالزَّاجِرَاتِ زَجْرًاۙ ﴿٢﴾ فَالتَّالِيَاتِ ذِكْرًاۙ ﴿٣﴾ اِنَّ اِلٰهَكُمْ لَوَاحِدٌۜ ﴿٤﴾ رَبُّ
السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَيْنَهُمَا وَرَبُّ الْمَشَارِقِۜ ﴿٥﴾ اِنَّا زَيَّنَّا السَّمَٓاءَ الدُّنْيَا بِزِينَةٍۨ الْكَوَاكِبِۙ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (وَالصَّٓافَّاتِ صَفًّاۙ) -** (Ey **Məhəmməd), and olsun o şəxslərə ki, mənim hüzurumda itaət və bəndəlik məqamında, həqiqətən və qəlbən səf-səf durub məni özlərinə əsl qayə sayıb, məndən başqa, heç bir şeyə iltifat etməzlər.**

**2) (فَالزَّاجِرَاتِ زَجْرًاۙ) - Və and olsun o şəxslərə ki, bizim öyüd-nəsihətimiz onlara təsir edib, hər bir çirkin əməldən özlərini qoruyurlar.**

**3) (فَالتَّالِيَاتِ ذِكْرًاۙ) - Və and olsun o şəxslərə ki, Allah-Təalanın açıq-aydın ayələrini oxuyub, onların itaət edilməsi vacib olan ehkamına tabe olub Qurani-Şərifi özlərinə rəhbər seçirlər.**

**4) (اِنَّ اِلٰهَكُمْ لَوَاحِدٌ) -** (Ey Məhəmməd), **Qüreyşə və müşriklərə de ki, Allah-Təala bu müqəddəs şəxslərə ona görə and içir ki, həqiqətən də, sizin məbudunuz yeganə olan Allah-Təaladır və ona şirk qoşmağınız layiq deyil.**

**5) (رَبُّ السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَيْنَهُمَا وَرَبُّ الْمَشَارِقِۜ) - Göylərin və yerin arasında olan hər bir şeyin, günəşin doğma və batma yerlərinin* rəbbi həmin yeganə olan Allah-Təaladır. Belə yeganə Allah-Təalaya şirk qoşmaq olarmı?**

*(*Qeyd:* *"Günəşin xüsusi hərəkətləri ilə necə ki keçmiş astronomlar deyirlər, ya da ki, yer kürəsinin hərəkətilə necə ki yeni astronomlar deyirlər: "Günəşin doğması və batması müxtəlif yerlərdən olduğu üçün Allah-Təala cəm şəklində "məşariq" (şərqlər) ifadəsini işlədir. Şərqlə birlikdə qərb də anlaşıldığı üçün ayədə "məğarib" (qərblər) sözü işlədilmədi).*

**6) (اِنَّا زَيَّنَّا السَّمَٓاءَ الدُّنْيَا بِزِينَةٍۨ الْكَوَاكِبِۙ) -** (Ey Məhəmməd), **həqiqətən, sizə yaxın olan** göyə ulduzların nuru ilə zinət verdik ki, gözünüzlə baxıb ibrət alasınız.**

*(**Qeyd:* *"Səma və göy bizim baş tərəfimizə deyilir. Göyün yaxınlığından məqsəd bizim gözümüzlə gördüyümüz yerdir. Əgər Allah-Təala bu qədər çox ulduzu bizim gözümüzlə görəməyəcəyimiz bir yerdə yerləşdirsəydi, hər hal-*

وَحِفْظًا مِنْ كُلِّ شَيْطَانٍ مَارِدٍۚ ﴿٧﴾ لَا يَسَّمَّعُونَ اِلَى الْمَلَاِ الْاَعْلٰى وَيُقْذَفُونَ مِنْ كُلِّ جَانِبٍۗ﴿٨﴾
دُحُورًا وَلَهُمْ عَذَابٌ وَاصِبٌۙ ﴿٩﴾ اِلَّا مَنْ خَطِفَ الْخَطْفَةَ فَاَتْبَعَهُ شِهَابٌ ثَاقِبٌ ﴿١٠﴾ فَاسْتَفْتِهِمْ
اَهُمْ اَشَدُّ خَلْقًا اَمْ مَنْ خَلَقْنَاۜ اِنَّا خَلَقْنَاهُمْ مِنْ طِينٍ لَازِبٍ﴿١١﴾

*da biz onlardan heç bir şey anlamazdıq. Necə ki astronomların sözünə görə bəzi ulduzlar var ki, vasitəsiz və alətsiz görünmür, bəziləri də hələlik heç alət vasitəsiylə də görünmür. Allahın əzəmət və qüdrəti nə qədər böyükdür).*

**7) (وَحِفْظًا مِنْ كُلِّ شَيْطَانٍ مَارِدٍۚ) - Ulduzların Allah-Təalanın tövhid və qüdrətinə olan işarəsini hər bir asi və xəbis şeytanın (şəri əmr edən nəfs) dərk edib ibrət alması üçün qoruduq. Şəri əmr edən xəbis nəfslər onların nurundan başqa heç bir şeyi, onların həqiqətini dərk edə bilməzlər.**

**8) (لَا يَسَّمَّعُونَ اِلَى الْمَلَاِ الْاَعْلٰى) - O xəbis nəfslər uca mərtəbəli Adəm övladının şərəfli böyüklərinə (peyğəmbərlərə) qulaq asa bilməzlər.**

**(وَيُقْذَفُونَ مِنْ كُلِّ جَانِبٍ دُحُورًا) - Hər bir tərəfdən Allah-Təalanın qəhr edən oxları Allahın rəhmətindən kənar etmək üçün şəri əmr edən xəbis nəfslərin qəlblərinə atılıb, onlar haqqı dərk etməkdən qəlbləri kor olub, həmişəlik zəlalətdə qalarlar.**

**9) (وَلَهُمْ عَذَابٌ وَاصِبٌ) - O nəfslərdən ötrü axirətdə həmişəlik əzab vardır.**

**10) (اِلَّا مَنْ خَطِفَ الْخَطْفَةَ فَاَتْبَعَهُ شِهَابٌ ثَاقِبٌ) - Əgər şəri əmr edən xəbis nəfslərdən biri təsadüfən Allah-Təalanın kəlamını peyğəmbərdən eşidib, sürətlə qaçsa ki, o kəlamı öz məqsədinə müvafiq olaraq istifadə edib özündən başqalarını da sapdıra, o vaxt Allah-Təalanın tərəfindən nurani, mübarək ulduz kimi batini bir od şöləsi onun qəlbinə dəyib, onu batinən yandırıb, o kəlam onun qəlbindən unutdurulub, digərlərini sapdırmağa qadir ola bilməz. (Bu əvvəlki ayələrdə nə gözəl incə rəmzli sözlər xəbis nəfislərin xüsusiyyətini və onların Allahın rəhmətindən qovulduğunu buyurur. Amma heyif ki, təfsirçilər bu ayələri şeytanların göylərə yüksəlib, oradan mələklərin kəlamını eşitməsi səbəbi ilə yandırıcı qığılcımlarla qovulması şəklində izah ediblər. Necə ki surənin əvvəlindəki ayələri** (vəs-saffat və s.) **mələklərə və buludları qamçı ilə sürməyə aid edibdir, təfsirçilərin sözlərinə baxan bəzi şəxslər mən həqirin təfsirini yanlış sayıb, nalayiq sözlər danışacaqlar. Lakin əgər bundan sonrakı ayələrə fikir verilsə, hər halda mən həqirin təfsirinin haqlılığı zahir və aşkar olar. Təfəkkür əhlinin diqqət etməsi tövsiyə olunur.**

**11) (فَاسْتَفْتِهِمْ اَهُمْ اَشَدُّ خَلْقًا اَمْ مَنْ خَلَقْنَاۜ) -** (Ey Məhəmməd), **şəri əmr edən xəbis nəfs sahibləri müşriklərdən hansı ki bizim qüdrət və tövhidimizi inkar edirlər, soruş ki, bəs onların təbiəti möhkəmdir, yoxsa onlardan başqa yaratdığımız məxluqların. (اِنَّا خَلَقْنَاهُمْ مِنْ طِينٍ لَازِبٍ) Və halbuki biz onları**

بَلْ عَجِبْتَ وَيَسْخَرُونَ ﴿١٢﴾ وَاِذَا ذُكِّرُوا لَا يَذْكُرُونَ ﴿١٣﴾ وَاِذَا رَاَوْا اٰيَةً يَسْتَسْخِرُونَ ﴿١٤﴾
وَقَالُوٓا اِنْ هٰذَآ اِلَّا سِحْرٌ مُبِينٌ ﴿١٥﴾ ءَاِذَا مِتْنَا وَكُنَّا تُرَابًا وَعِظَامًا ءَاِنَّا لَمَبْعُوثُونَ ﴿١٦﴾ اَوَاٰبَآؤُنَا
الْاَوَّلُونَ ﴿١٧﴾ قُلْ نَعَمْ وَاَنْتُمْ دَاخِرُونَ ﴿١٨﴾ فَاِنَّمَا هِيَ زَجْرَةٌ وَاحِدَةٌ فَاِذَا هُمْ يَنْظُرُونَ ﴿١٩﴾

---

**(insanı) yapışqan olan palçıqdan yaratdıq. Palçıq zəif, xırda bir şeydir, o palçıq çevrilib ət, qan, sümük olubdur. Hansı ki az bir zaman ruhsuz qalanda pozulur, bizim digər məxluqumuzun yanında insanın zahiri heç bir şey deyildir. Bununla belə bizim qüdrətimizə tabe olmurlar.**

**12) (بَلْ عَجِبْتَ وَيَسْخَرُونَ) -** (Ey Məhəmməd), **bəlkə sən Qurani-Şərif kimi kitabı və Allah-Təalanın qüdrətini müşriklərin inkar etməsindən təəccüb edirsən, onlar sənin təəccüb etməyinə məsxərə edib istehza edirlər.**

**13) (وَاِذَا ذُكِّرُوا لَا يَذْكُرُونَ) - Müşriklərin dəb və adətləri budur. O zaman ki, onlara öyüd-nəsihət edildi, qəbul etməyib inkar edirlər və halbuki insan gərək hər bir faydalı sözü qəbul edib, nəfsini rəzil şeylərdən təmiz saxlasın. Nəsihət qəbul etməyən şəxs insanlıqdan kənardır.**

**14) (وَاِذَا رَاَوْا اٰيَةً يَسْتَسْخِرُونَ)** - (Ey Məhəmməd), **o zaman ki, müşriklər Allah-Təala tərəfindən sənin doğruluğuna dəlil olan Qurani-Şərifin ayə və sübutlarından birini gördülər, ona etibar gözüylə baxmayıb, daha da bir-birlərini o dəlillərə istehza etməyə dəvət edərlər.**

**15) (وَقَالُوٓا اِنْ هٰذَآ اِلَّا سِحْرٌ مُبِينٌ) - İstehza edib dedilər: "Bu Quran açıq-aşkar sehrdir.** (Ağıllı insan gərək hər bir şeydə təfəkkür edib, ondan sonra ona yaxşı və ya yaman desin. Təfəkkür etmədən yaxşı bir şeyi rədd edib, ona münasib olmayan ad qoymaq, məsələn, Qurana sehr demək ağıldan kənar bir şeydir.)

**16) (ءَاِذَا مِتْنَا وَكُنَّا تُرَابًا وَعِظَامًا ءَاِنَّا لَمَبْعُوثُونَ) - Qiyamət gününü inkar edib dedilər: "Bəs o zaman ki ölüm bizə gəldi, çürüyüb, torpaq olub, təkcə sümüklərimiz qalacaq, (halbuki sümükləri də çürüyəcəkdir), o vaxt yenidən həyata gəlib diriləcəyik?**

**17) (اَوَاٰبَآؤُنَا الْاَوَّلُونَ) - Bəs daha öncəki ata-babalarımız da yenidən diriləcəkdir? Heç vaxt belə şey olmaz.**

**18) (قُلْ نَعَمْ وَاَنْتُمْ دَاخِرُونَ)** - (Ey Məhəmməd), **qiyaməti inkar edənlərin cavabında de ki, bəli, hamınız zəlil olduğunuz halda dirilib, məhşərdə hazır olacaqsınız. Allah-Təalanın qüdrət və hakimiyyətindən kənar ola bilməyəcəksiniz.**

**19) (فَاِنَّمَا هِيَ زَجْرَةٌ وَاحِدَةٌ فَاِذَا هُمْ يَنْظُرُونَ)** - (Ey Məhəmməd), **insanların yenidən dirilməsi üçün Allah-Təala tərəfindən bircə səs gəlib, o qəfil**

وَقَالُوا يَا وَيْلَنَا هٰذَا يَوْمُ الدِّينِ﴿٢٠﴾ هٰذَا يَوْمُ الْفَصْلِ الَّذِي كُنْتُمْ بِهِ تُكَذِّبُونَ﴿٢١﴾ اُحْشُرُوا الَّذِينَ ظَلَمُوا وَاَزْوَاجَهُمْ وَمَا كَانُوا يَعْبُدُونَ﴿٢٢﴾ مِنْ دُونِ اللّٰهِ فَاهْدُوهُمْ اِلٰى صِرَاطِ الْجَحِيمِ﴿٢٣﴾ وَقِفُوهُمْ اِنَّهُمْ مَسْؤُلُونَ﴿٢٤﴾ مَا لَكُمْ لَا تَنَاصَرُونَ﴿٢٥﴾ بَلْ هُمُ الْيَوْمَ مُسْتَسْلِمُونَ﴿٢٦﴾ وَاَقْبَلَ بَعْضُهُمْ عَلٰى بَعْضٍ يَتَسَآءَلُونَ﴿٢٧﴾

---

**səsdən hamısı qaranlıq torpaqdan baş qaldırıb həyata gəlib, hər bir şeyi görərlər.** (Allah-Təalanın başlanğıcda və ya yenidən yaratmasında səsə və ya digər şeylərə ehtiyacı yoxdur. Bəlkə, insanları bir anda diriltməyinə işarə üçün misal verir. Bir dəstə dəvəyə ya qoyun otlamaqla məşğul olduqları halda, çobanın qorxunc səsi ilə necə ki hamısı dəhşətə gəlib, sürətlə bir anda bir yerə cəm olarlar, Allah-Təalanın yaratması da belədir. Allah-Təalanın istəyi və səsi ilə elə ki, onlar yaradıldı, bir anda gecikmədən hamısı qoyun sürüsü kimi bir yerə toplanarlar. Allahın qüdrət və əzəməti necə də böyükdür).

**20) (وَقَالُوا يَا وَيْلَنَا هٰذَا يَوْمُ الدِّينِ) - Elə ki, qiyaməti inkar edənlər dirilib məhşərdə hazır oldular, o vaxt peşmançılıqla deyərlər: “Yazıq olsun bizə, qiyaməti inkar etdik, budur, cəza günü gəldi.**

**21) (هٰذَا يَوْمُ الْفَصْلِ الَّذِي كُنْتُمْ بِهِ تُكَذِّبُونَ) - Ey Məhəmməd, bizim tərəfimizdən qiyaməti inkar edənlərə deyilər: “Haqla batil arasında hökm olunub fərq qoyulan gün bu gündür ki, siz inkar edirdiniz. Necə oldu ki, bu gün vaqe oldu?**

**22-23) (اُحْشُرُوا الَّذِينَ ظَلَمُوا وَاَزْوَاجَهُمْ وَمَا كَانُوا يَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ فَاهْدُوهُمْ اِلٰى صِرَاطِ الْجَحِيمِ)** - (Ey Məhəmməd), **qiyamət günündə qoşunumuza hökm edərik ki, zalımları və onlar kimi olan digər günahkarları və onların əməllərinə razı olanları və Allah-Təaladan başqa ibadət etdikləri və şəfaət istədikləri bütlərin hamısını bir yerə cəm edin, ondan sonra cəhənnəmin yolunu onlara göstərərik ki, gedib cəhənnəmə daxil olsunlar.**

**24) (وَقِفُوهُمْ اِنَّهُمْ مَسْؤُلُونَ) - Elə ki, onları cəhənnəm tərəfinə apardılar, o məqamda Allah-Təaladan xitab gələr ki, saxlayın onları, həqiqətən də, onlardan soruşulacaqdır.**

**25) (مَا لَكُمْ لَا تَنَاصَرُونَ) - Onlardan belə soruşular: “Siz ki, dünyada bir-birinizi qoruyub, kömək edib Allah-Təalanın peyğəmbərlərilə qovğa edirdiniz, indi bugünkü gündə nə olubdur sizə ki, bir-birinizə kömək etməyib, belə fəlakətdən bir-birinizi xilas etmirsiniz?” (Onlar cavab verməyə qadir olmazlar).**

**26) (بَلْ هُمُ الْيَوْمَ مُسْتَسْلِمُونَ)** - (Ey Məhəmməd), **bugünkü gündə nəinki bir-birinə kömək etməyə qadir olmazlar, hətta bir-birilərini tərk edərlər.**

**27) (وَاَقْبَلَ بَعْضُهُمْ عَلٰى بَعْضٍ يَتَسَآءَلُونَ) - O vaxt tabe olanlar və tabe edənlər, böyüklər və kiçiklər bir-birilərinə baxıb soruşarlar.**

قَالُوٓا اِنَّكُمْ كُنْتُمْ تَأْتُونَنَا عَنِ الْيَمِينِ﴿٢٨﴾ قَالُوا بَلْ لَمْ تَكُونُوا مُؤْمِنِينَۚ ﴿٢٩﴾ وَمَا كَانَ لَنَا عَلَيْكُمْ مِنْ سُلْطَانٍۚ بَلْ كُنْتُمْ قَوْمًا طَاغِينَ ﴿٣٠﴾ فَحَقَّ عَلَيْنَا قَوْلُ رَبِّنَٓا اِنَّا لَذَٓائِقُونَ ﴿٣١﴾ فَاَغْوَيْنَاكُمْ اِنَّا كُنَّا غَاوِينَ﴿٣٢﴾ فَاِنَّهُمْ يَوْمَئِذٍ فِي الْعَذَابِ مُشْتَرِكُونَ﴿٣٣﴾ اِنَّا كَذٰلِكَ نَفْعَلُ بِالْمُجْرِمِينَ ﴿٣٤﴾ اِنَّهُمْ كَانُوٓا اِذَا قِيلَ لَهُمْ لَٓا اِلٰهَ اِلَّا اللّٰهُ يَسْتَكْبِرُونَۙ ﴿٣٥﴾ وَيَقُولُونَ اَئِنَّا لَتَارِكُوٓا اٰلِهَتِنَا لِشَاعِرٍ مَجْنُونٍّ ﴿٣٦﴾

---

**28) (قَالُوٓا اِنَّكُمْ كُنْتُمْ تَأْتُونَنَا عَنِ الْيَمِينِ) - Tabe olanlar öz rəislərinə deyərlər: “Siz bizə zorla qələbə edib bizi zəlalətə saldınız”.**

**29) (قَالُوا بَلْ لَمْ تَكُونُوا مُؤْمِنِينَ) - Rəislər özlərinə tabe olanlara deyərlər: “Sizin heç imanınız yox idi ki, biz sizi imandan çıxardıb, zəlalətə salaq, siz özünüz kafir idiniz.**

**30) (وَمَا كَانَ لَنَا عَلَيْكُمْ مِنْ سُلْطَانٍۚ) - Bizim sizə heç bir təzyiqimiz yox idi ki, sizi zorla imandan çıxardaydıq. (بَلْ كُنْتُمْ قَوْمًا طَاغِينَ) - Bəlkə siz özünüz zəlalət və azğınlığı hidayət və imana üstün sayan bir camaat idiniz.**

**31) (فَحَقَّ عَلَيْنَا قَوْلُ رَبِّنَٓا اِنَّا لَذَٓائِقُونَ) - Allah-Təalanın əzab vədinə öz əməlimiz səbəbi ilə layiq olduq. Gərək biz həqiqətən, Allah-Təalanın əzabını dadaq.**

**32) (فَاَغْوَيْنَاكُمْ اِنَّا كُنَّا غَاوِينَ) - Həqiqətən, biz özümüz dünyada küfr və zəlalət içində idik, siz də küfr və zəlalətdə olduğunuz üçün sizi dəvət etdik. Ta ki, həmin küfr və zəlalət içində qalıb imana gəlməyəsiniz. Siz də öz ixtiyarınızla zəlalətdə qaldınız. Yoxsa biz sizi zorla küfrə vadar etmədik. Necə ki, siz bizə böhtan edirsiniz.** (Qiyamət günündə hər bir şəxs öz imkanı ölçüsündə öz nəfsini töhmətdən xilas etməyə çalışacaqdır).

**33) (فَاِنَّهُمْ يَوْمَئِذٍ فِي الْعَذَابِ مُشْتَرِكُونَ)** - (Ey Məhəmməd), **rəislərin və onlara tabe olanların bu dedi-qodusu onlara fayda verməyibdir. Həqiqətən, qiyamət günündə hamısı əzabda şərik olacaqlar.**

**34) (اِنَّا كَذٰلِكَ نَفْعَلُ بِالْمُجْرِمِينَ)** - (Ey Məhəmməd), **həqiqətən, biz günahkarlarla belə (əvvəlcə bəhs olunan kimi) rəftar edib onlara əzab edərik. (Öz günahları onların əzabına bais olar).**

**35) (اِنَّهُمْ كَانُوٓا اِذَا قِيلَ لَهُمْ لَٓا اِلٰهَ اِلَّا اللّٰهُ يَسْتَكْبِرُونَ)** - (Ey Məhəmməd), **həqiqətən, o zaman ki, müşriklər kəlmeyi-tövhidi (لَٓا اِلٰهَ اِلَّا اللّٰهُ) - eşidəndə, onlara deyilirdi: “Bu kəlməni deyin, onlar təkəbbürlənib, tövhidə tabe olmayıb, şirk içində qaldılar.**

**36) (وَيَقُولُونَ اَئِنَّا لَتَارِكُوٓا اٰلِهَتِنَا لِشَاعِرٍ مَجْنُونٍّ) - Şirkdə qalıb deyirdilər: “Bəs biz məbudlarımızı** (bütlərimizi) **bir dəli şairdən** (Məhəmməddən) **ötrü tərk edək? Belə şey olarmı?”**

بَلْ جَآءَ بِالْحَقِّ وَصَدَّقَ الْمُرْسَلِينَ ﴿٣٧﴾ اِنَّكُمْ لَذَآئِقُوا الْعَذَابِ الْاَلِيمِۚ ﴿٣٨﴾ وَمَا تُجْزَوْنَ اِلَّا مَا
كُنْتُمْ تَعْمَلُونَۙ ﴿٣٩﴾ اِلَّا عِبَادَ اللّٰهِ الْمُخْلَصِينَ ﴿٤٠﴾ اُو۬لٰٓئِكَ لَهُمْ رِزْقٌ مَعْلُومٌۙ ﴿٤١﴾ فَوَاكِهُۚ وَهُمْ
مُكْرَمُونَۙ ﴿٤٢﴾ ف۪ي جَنَّاتِ النَّع۪يمِۙ ﴿٤٣﴾ عَلٰى سُرُرٍ مُتَقَابِل۪ينَ ﴿٤٤﴾ يُطَافُ عَلَيْهِمْ بِكَاْسٍ مِنْ
مَع۪ينٍۙ ﴿٤٥﴾ بَيْضَآءَ لَذَّةٍ لِلشَّارِب۪ينَۚ ﴿٤٦﴾ لَا ف۪يهَا غَوْلٌ وَلَا هُمْ عَنْهَا يُنْزَفُونَ ﴿٤٧﴾

---

**37) (بَلْ جَآءَ بِالْحَقِّ وَصَدَّقَ الْمُرْسَلِينَ) - Elə deyil ki, müşriklər deyirlər.** (Məhəmməd) **dəli deyildir. Bəlkə** (Məhəmməd) **haqq və ədalətlə Allah-Təala tərəfindən gəlib-gedən peyğəmbərləri də təsdiq edibdir. Necə ki, onlar şirki qadağan etməyi əmr edirdilər, habelə bu Məhəmməd də onu əmr edir. Başqa bir qəribə əmr gətirməyib ki, siz ondan nifrət edəsiniz.**

**38) (اِنَّكُمْ لَذَآئِقُوا الْعَذَابِ الْاَلِيمِۚ) - Həqiqətən, siz müşriklər (dünya və axirətdə) əziyyət verən əzabı dadacaqsınız.** (Dünyada müşriklərin Bədir və digər savaşlarda əzaba düçar olmaları, axirətdəki əzabın doğruluğuna da dəlildir).

**39) (وَمَا تُجْزَوْنَ اِلَّا مَا كُنْتُمْ تَعْمَلُونَ) - Siz müşrik və günahkarlara öz əməllərinizin qarşılığından başqa cəza verilməz, sizə haqsız zülm edilməyəcəkdir.**

**40) (اِلَّا عِبَادَ اللّٰهِ الْمُخْلَصِينَ) - Lakin Allah-Təalanın xalis bəndələrinin əhvalı qiyamət günündə görək necə olacaq?**

**41) (اُو۬لٰٓئِكَ لَهُمْ رِزْقٌ مَعْلُومٌ) - O xalis bəndələrdən ötrü Allah-Təalanın yanında məlum və müəyyən edilmiş ruzi vardır.**

**42) (فَوَاكِهُۚ وَهُمْ مُكْرَمُونَ) - O məlum ruzi hər bir növ meyvələrdir ki, onları ləzzətdən ötrü yeyərlər. (Nəinki qida və səhhəti qorumaq üçün, bəndələr axirətdə elə yaradılır ki, ehtiyacları qida və səhhəti qorumaq üçün olmayıb, hər bir şeyi ləzzəti səbəbi ilə yeyərlər). Özləri də Allah-Təalanın nəzərində əziz və möhtərəm olarlar. (Allah-Təalanın nəzərində əziz, hörmətli olmaq böyük səadətdir, necə ki, zəlil və rəzil olmaq böyük bədbəxtlikdir).**

**43) (ف۪ي جَنَّاتِ النَّع۪يمِۙ) - Mənzilləri həmişəlik cənnətlərdə olar.**

**44) (عَلٰى سُرُرٍ مُتَقَابِل۪ينَ) - Özləri də üzbəüz taxtların üstündə oturub söhbətlə məşğul olarlar.**

**45) (يُطَافُ عَلَيْهِمْ بِكَاْسٍ مِنْ مَع۪ينٍۙ) - Allah-Təalanın öz kamil qüdrəti ilə yaratdığı şərab çeşməsilə dolu piyalələri xidmətçilər dolandırıb onları içizdirərlər.**

**46) (بَيْضَآءَ لَذَّةٍ لِلشَّارِب۪ينَ) - Piyalə və şərabın rəngi ağ olduğu üçün şərab içənlərə ləzzət verər.**

**47) (لَا ف۪يهَا غَوْلٌ) - O şərabda dünya şərabının xüsusiyyəti olmaz. Nə də onda ağılı pozub, fəlakət törətmək halı yoxdur. Necə ki, dünya şərabında**

وَعِنْدَهُمْ قَاصِرَاتُ الطَّرْفِ عِينٌ ﴿٤٨﴾ كَاَنَّهُنَّ بَيْضٌ مَكْنُونٌ ﴿٤٩﴾ فَاَقْبَلَ بَعْضُهُمْ عَلٰى بَعْضٍ
يَتَسَٓاءَلُونَ﴿٥٠﴾ قَالَ قَٓائِلٌ مِنْهُمْ اِنّ۪ي كَانَ ل۪ي قَر۪ينٌ ﴿٥١﴾ يَقُولُ اَئِنَّكَ لَمِنَ الْمُصَدِّق۪ينَ﴿٥٢﴾ ءَاِذَا
مِتْنَا وَكُنَّا تُرَابًا وَعِظَامًا ءَاِنَّا لَمَد۪ينُونَ﴿٥٣﴾ قَالَ هَلْ اَنْتُمْ مُطَّلِعُونَ ﴿٥٤﴾ فَاطَّلَعَ فَرَاٰهُ ف۪ي سَوَٓاءِ
الْجَح۪يمِ ﴿٥٥﴾

---

**var. (وَلَا هُمْ عَنْهَا يُنْزَفُونَ) - Və nə də onlar o şərabdan məst olmazlar. Necə ki, dünya şərabından olarlar.**

**48) (وَعِنْدَهُمْ قَاصِرَاتُ الطَّرْفِ عِينٌ) - Cənnət əhlinin yanında, onlara məxsus olan və gözlərini ancaq ərlərinə dikmiş iri gözlü, gözəl hurilər olar, hansı ki, onlardan başqasına iltifat etməzlər.** (Necə ki dünya arvadları iltifat edir).

**49) (كَاَنَّهُنَّ بَيْضٌ مَكْنُونٌ) - Sanki o hurilər rənglərinin ağlığına görə da hava təsirindən gizlənən dəvəquşu yumurtasıdırlar.** (Ərəb qadınlarının ağlığını dəvəquşu yumurtasına oxşadıb "Beyzatul-xadur" (örtü içindəki ağ) deyirlər. Bu ayədən Allah-Təalanın Qurani-Şərifdə adət-ənənə üzrə danışdığı məlum olur. İnsan nəsli qidaya və şəhvətə düşkün olduğu üçün Allah-Təala onların xahiş etdiyi şeyləri onlara vəd etməklə (Ata oğlunu məktəbə və sənətə göndərəndə vəd etdiyi kimi) tövhid və maarifə və gözəl əxlaqa dəvət edir. Təfəkkür etmək lazımdır).

**50) (فَاَقْبَلَ بَعْضُهُمْ عَلٰى بَعْضٍ يَتَسَٓاءَلُونَ) -** (Ey Məhəmməd), **cənnət əhli təxtlərin üstündə əyləşib şərab içərkən, bir-birilərinə yönəlib, dünyadakı əhvalatları soruşarlar.**

**51) (قَالَ قَٓائِلٌ مِنْهُمْ اِنّ۪ي كَانَ ل۪ي قَر۪ينٌ) - Söhbət məqamında onlardan bir nəfər deyər: "Həqiqətən, mənim dünyada bir yoldaşım var idi. Amma axirəti inkar edən idi.**

**52) (يَقُولُ اَئِنَّكَ لَمِنَ الْمُصَدِّق۪ينَ) - O yoldaş mənə deyərdi: "Bəs sən yəqin ki, qiyaməti və axirəti təsdiq edənlərdənsən?"**

**53) (ءَاِذَا مِتْنَا وَكُنَّا تُرَابًا وَعِظَامًا ءَاِنَّا لَمَد۪ينُونَ) - Mənə deyirdi: "O zaman ki ölüm bizə gəlib, torpaq və sümük olduq ondan sonra yenidən həyata gəlib, haqq-hesab və cəzadan ötrü diriləcəyik?**

**54) (قَالَ هَلْ اَنْتُمْ مُطَّلِعُونَ) -** (Ey Məhəmməd), **o şəxs cənnət əhli olan yoldaşlarına deyir: Xahiş edirsiniz ki, mənim o yoldaşımın mənzilinə və əhvalına agah olasınız?** (Onlar deyir, əlbəttə, xahiş edirik, görək, inkarçı olan o şəxsin əhvalı necədir?)

**55) (فَاطَّلَعَ فَرَاٰهُ ف۪ي سَوَٓاءِ الْجَح۪يمِ) - Cəhənnəmə baxıb yoldaşını cəhənnəmin ortasında şiddətli əzab içində görür.**

قَالَ تَاللّٰهِ اِنْ كِدْتَ لَتُرْدِينِۙ ﴿٥٦﴾ وَلَوْلَا نِعْمَةُ رَبّ۪ي لَكُنْتُ مِنَ الْمُحْضَر۪ينَ ﴿٥٧﴾ اَفَمَا نَحْنُ
بِمَيِّت۪ينَۙ ﴿٥٨﴾ اِلَّا مَوْتَتَنَا الْاُو۫لٰى وَمَا نَحْنُ بِمُعَذَّب۪ينَ ﴿٥٩﴾ اِنَّ هٰذَا لَهُوَ الْفَوْزُ الْعَظ۪يمُ ﴿٦٠﴾
لِمِثْلِ هٰذَا فَلْيَعْمَلِ الْعَامِلُونَ ﴿٦١﴾ اَذٰلِكَ خَيْرٌ نُزُلًا اَمْ شَجَرَةُ الزَّقُّومِ ﴿٦٢﴾

---

**56) (قَالَ تَاللّٰهِ اِنْ كِدْتَ لَتُرْدِينِۙ) - Öz yoldaşına xitab edib deyir: “And olsun Allah-Təalaya ki, az qala məni də islam dinindən çıxarıb, qiyaməti inkar etdirib, fəlakətə salacaqdın).**

**57) (وَلَوْلَا نِعْمَةُ رَبّ۪ي لَكُنْتُ مِنَ الْمُحْضَر۪ينَ) - Əgər mənim rəbbim Allah-Təalanın nemәti və yardımı mənə çatmayıb, sənin kimi qiyaməti inkar edib, islam dinində qalmasaydım, əlbəttə, mən də sənin kimi cəhənnəmə əzabdan ötrü aparılanlardan olardım. Həmd olsun Allah-Təalaya ki, yardım etdi, sənin kimi qiyaməti inkar edənlərdən olmadım.”**

**58) (اَفَمَا نَحْنُ بِمَيِّت۪ينَ) - Möminlər axirətdə fərəh və sevinc içində deyərlər: “Bəs biz burada həmişə nemət içində olub daha ölüm bizə gəlməyəcəkdir?**

**59) (اِلَّا مَوْتَتَنَا الْاُو۫لٰى وَمَا نَحْنُ بِمُعَذَّب۪ينَ) - Ancaq dünyada həmin ölüm ki, bir dəfə bizə gəldi, ondan başqa daha bizdən ötrü ölüm olmayıb, bizə əzab da olmayacaqdır. Belə məlum olur ki, bu nemətlər bizim üçün həmişə olacaq. (Allah-Təala tərəfindən ölüm olmayıb, həmişə cənnətdə olacaqları onlara elan olunub xatircəm olarlar. (Qiyamət günündə möminlərin halı belə olur. Amma kafir və münafiqlər hər bir saatda ölümü arzu edib, onlardan ötrü ölüm olmayıb, həmişə əzabda olacaqlar.**

**60) (اِنَّ هٰذَا لَهُوَ الْفَوْزُ الْعَظ۪يمُ) -** (Ey Məhəmməd), **həqiqətən, möminlərin cənnətdə həmişə nemət içində olub belə rahat və asudə olmaları böyük mükafat və savaba çatmaqdır. Daha bundan böyük nə mükafat və savab var?**

**61) (لِمِثْلِ هٰذَا فَلْيَعْمَلِ الْعَامِلُونَ) - Dünyada hər bir əməl edən şəxslər gərək belə savaba yetişməkdən ötrü əməl etsinlər.** (Bundan sonra bəhs olunan ayələrdə cəhənnəm əhlinin bəzi əzabları qeyd olunur).

**62) (اَذٰلِكَ خَيْرٌ نُزُلًا اَمْ شَجَرَةُ الزَّقُّومِ) -** (Ey Məhəmməd), **müşriklərə de ki, bəs behiştin nemətləri və onlardan hasil olan ləzzətlər yaxşıdır, yoxsa cəhənnəm əhlinin qidası olan zəqqum* ağacının meyvəsi?**

*(*Qeyd: Zəqqum Ərəbistanda (Tihamə) çölündə bitən yabanı bir ağacdır. Onun meyvəsi son dərəcə acı olur, Allah-Təala cəhənnəm əhlinin yeməyini ona oxşadır, guya həmin ağacdan cəhənnəmdə vardır və cəhənnəm əhli onun meyvəsini məcbur qalıb yeyirlər. Qurani-Şərifdə Allah adətən bilinməyən və insanların təsəvvüründən kənar olan şeyləri dünya dili ilə bizlərə bildirir. Necə*

إِنَّا جَعَلْنَاهَا فِتْنَةً لِلظَّالِمِينَ ﴿٦٣﴾ اِنَّهَا شَجَرَةٌ تَخْرُجُ فِيٓ اَصْلِ الْجَحِيمِۙ ﴿٦٤﴾ طَلْعُهَا كَاَنَّهُ رُؤُ۫سُ الشَّيَاطِينِ ﴿٦٥﴾ فَاِنَّهُمْ لَاٰكِلُونَ مِنْهَا فَمَالِؤُ۫نَ مِنْهَا الْبُطُونَۜ ﴿٦٦﴾ ثُمَّ اِنَّ لَهُمْ عَلَيْهَا لَشَوْبًا مِنْ حَم۪يمٍۚ ﴿٦٧﴾ ثُمَّ اِنَّ مَرْجِعَهُمْ لَاِلَى الْجَح۪يمِ ﴿٦٨﴾ اِنَّهُمْ اَلْفَوْا اٰبَٓاءَهُمْ ضَٓالّ۪ينَۙ ﴿٦٩﴾

---

*ki, behişt əhlinin behiştdə rahat olub ləzzət almalarını növbənöv meyvələrlə izah edir. Hansı ki, dünyada o şeyləri biz tanıyırıq, savab və əzabı onlarla bizə təlqin edir, lakin axirət həyatı dünyadan başqadır. Əgər bu şeylərin eynisi axirətdə mövcud olsa, o, axirət olmayıb dünya olar).*

**63)** (اِنَّا جَعَلْنَاهَا فِتْنَةً لِلظَّالِمِينَ) - (Ey Məhəmməd), **həqiqətən, biz o zəqqum ağacının meyvəsini zalımlardan ötrü dərd və əzab təyin etdik.**

**64)** (اِنَّهَا شَجَرَةٌ تَخْرُجُ فِيٓ اَصْلِ الْجَحِيمِۙ) - **O zəqqum ağacı elə bir ağacdır ki, cəhənnəmin dibindən çıxıb, budaqları onun ən aşağı tərəflərini də bürüyər.** (Zülm və xəbislik sifəti zalım və günahkarın qəlbindən peyda olub, onun əlamətləri o şəxsin bütün orqanlarında zahir və aşkar olar).

**65)** (طَلْعُهَا كَاَنَّهُ رُؤُ۫سُ الشَّيَاطِينِ) - **O zəqqum ağacının meyvəsi zahirən elə çirkindir ki, sanki şeytanların başıdır və onlara oxşayır.** (Adət-ənənədə hər bir gözəl şey məlaikəyə və çirkin şey də şeytana oxşadıldığı üçün Allah-Təala zəqqum ağacının meyvəsini şeytanın başına oxşatdı. Bu oxşatmanın adına bəlağət elmində xəyali bənzətmə deyilir. Necə ki, şeytanın başını xəyalən təsəvvür etməklə insan ondan dəhşətə gəlib hürkür, habelə zülm və xəbislik sifətinin izlərinin zalımın orqanlarında zahir olmasından ağıllı şəxslər o cür nifrət edərlər).

**66)** (فَاِنَّهُمْ لَاٰكِلُونَ مِنْهَا فَمَالِؤُ۫نَ مِنْهَا الْبُطُونَ) - **Cəhənnəm əhli məcburən zəqqum ağacının meyvəsindən yeyib qarınlarını doldururlar.** (Onun yeməyindən başqa, qarınlarının dolu olmağı da onlara son dərəcə əziyyət verir. (Habelə zalımların xəbis sifəti, qarınlarının dolu olmağı onlardan ötrü böyük bir bəladır.)

**67)** (ثُمَّ اِنَّ لَهُمْ عَلَيْهَا لَشَوْبًا مِنْ حَم۪يمٍۚ) - **Yeməkdən sonra şəxsin suya ehtiyacı olur. Cəhənnəm əhli zəqqum ağacının meyvəsindən yeyəndən sonra onlardan ötrü cəhənnəmdə o zəqqumla qarışmış, son dərəcə isti su olar ki, onun hərarəti onların üzlərini yandırıb bağırsaqlarını doğrayar.**

**68)** (ثُمَّ اِنَّ مَرْجِعَهُمْ لَاِلَى الْجَح۪يمِ) - **Cəhənnəm əhlini əzab edildikləri mənzillərindən çıxarıb, cəhənnəmin dibinə, zəqqum ağacının meyvəsindən yeməkdən ötrü apararlar. Elə ki, məcburən onun meyvəsindən yedilər, ondan sonra qayıdacaqları yer cəhənnəmdəki əsl mənzilləridir.**

**69)** ( اِنَّهُمْ اَلْفَوْا اٰبَٓاءَهُمْ ضَٓالّ۪ينَ) - (Ey Məhəmməd), **zalımlara belə əzab olunması ata-babalarını təqlid edib, onlara tabe olmaları səbəbi ilədir. Həqiqətən, onlar ata-babalarını sapqınlıq və zəlillik içində tapıb onlara tabe oldular.**

فَهُمْ عَلٰى اٰثَارِهِمْ يُهْرَعُونَ﴿٧٠﴾ وَلَقَدْ ضَلَّ قَبْلَهُمْ اَكْثَرُ الْاَوَّلِينَۙ ﴿٧١﴾ وَلَقَدْ اَرْسَلْنَا فِيهِمْ مُنْذِرِينَ
﴿٧٢﴾ فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الْمُنْذَرِينَۙ ﴿٧٣﴾ اِلَّا عِبَادَ اللّٰهِ الْمُخْلَصِينَ۟ ﴿٧٤﴾ وَلَقَدْ نَادٰينَا نُوحٌ فَلَنِعْمَ
الْمُجِيبُونَۘ ﴿٧٥﴾ وَنَجَّيْنَاهُ وَاَهْلَهُ مِنَ الْكَرْبِ الْعَظِيمِۘ ﴿٧٦﴾ وَجَعَلْنَا ذُرِّيَّتَهُ هُمُ الْبَاقِينَۘ ﴿٧٧﴾ وَتَرَكْنَا
عَلَيْهِ فِي الْاٰخِرِينَۘ ﴿٧٨﴾ سَلَامٌ عَلٰى نُوحٍ فِي الْعَالَمِينَ ﴿٧٩﴾ اِنَّا كَذٰلِكَ نَجْزِي الْمُحْسِنِينَ ﴿٨٠﴾

---

**70) (فَهُمْ عَلٰى اٰثَارِهِمْ يُهْرَعُونَ) - Onlar da ata-babalarının yolu ilə sürətlə gedib, onların din və məzhəblərini fikirləşmədən qəbul etdilər.**

**71) (وَلَقَدْ ضَلَّ قَبْلَهُمْ اَكْثَرُ الْاَوَّلِينَ)** - (Ey Məhəmməd), **həqiqətən, (Qüreyş) camaatından əvvəlkilərin əksəriyyəti zəlalətə vaqe oldular.**

**72) (وَلَقَدْ اَرْسَلْنَا فِيهِمْ مُنْذِرِينَ) - Həqiqətən, bundan əvvəl keçən camaatların arasından onlara bizim əzabımızdan qorxudan peyğəmbərlər göndərdik ki, bəlkə ağıllanıb itaətə gələlər. Lakin itaət etməyib asi oldular.**

**73) (فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الْمُنْذَرِينَ) - Bax, gör ki, (Ey Məhəmməd), Allah-Təalanın əzabı ilə qorxudulub, lakin itaət etməyən zalımların aqibəti necə oldu. Hamısına əzab gəlib həlak oldular.**

**74) (اِلَّا عِبَادَ اللّٰهِ الْمُخْلَصِينَ) - Ancaq Allah-Təalanın xalis bəndələri əzabdan nicat tapdılar. Onlardan başqası həlak oldular.** (Bundan sonra Allah-Təala o camaatlardan bəzisinin əhvalatını anlatmağa başlayır).

**75) (وَلَقَدْ نَادٰينَا نُوحٌ فَلَنِعْمَ الْمُجِيبُونَ)** - (Ey Məhəmməd), **həqiqətən, Nuh ə.s. öz xalqının küfr və nifaqından təngə gəlib imanlarından məyus olub, onlara əzab göndərib həlak etməkdən ötrü bizə dua etdi. Biz də onun duasını qəbul edib gözəl şəkildə ona cavab verdik. Bizi çağıranların duasını çox yaxşı və gözəl qəbul edənik.**

**76) (وَنَجَّيْنَاهُ وَاَهْلَهُ مِنَ الْكَرْبِ الْعَظِيمِ)** - (Ey Məhəmməd), **Nuhun özünü və onun ailəsini böyük məşəqqətdən (suya qərq olmaqdan) qurtardıq.**

**77) (وَجَعَلْنَا ذُرِّيَّتَهُ هُمُ الْبَاقِينَ) - Nuhun nəslini yer üzündə sağ-salim etdik.** (Nuhun 3 oğlu - Sam, Ham, Yafətdən insanlığın əksəriyyəti meydana gəldi).

**78) (وَتَرَكْنَا عَلَيْهِ فِي الْاٰخِرِينَ) - Nuhdan ötrü onun adını ondan sonra gələn ümmətlərin arasında yaşatdıq.**

**79) (سَلَامٌ عَلٰى نُوحٍ فِي الْعَالَمِينَ) - Hər bir millət Nuha salam göndərib ona təzim edirlər. Bu salam göndərmək cəmi aləmlərin arasında Nuhdan ötrü sabit və bərqərardır. Hamısı ona salam göndərirlər.**

**80) (اِنَّا كَذٰلِكَ نَجْزِي الْمُحْسِنِينَ)** - (Ey Məhəmməd), **həqiqətən, biz yaxşı əməl sahiblərinə Nuha verdiyimiz kimi qarşılıq verib onu hər bir millət tərəfindən sevilən etdik.**

إِنَّهُ مِنْ عِبَادِنَا الْمُؤْمِنِينَ ﴿٨١﴾ ثُمَّ اَغْرَقْنَا الْاٰخَرِينَ ﴿٨٢﴾ وَاِنَّ مِنْ شِيعَتِهِ لَاِبْرٰهِيمَ ﴿٨٣﴾ اِذْ جَآءَ رَبَّهُ بِقَلْبٍ سَلِيمٍ ﴿٨٤﴾ اِذْ قَالَ لِاَبِيهِ وَقَوْمِهِ مَاذَا تَعْبُدُونَ ﴿٨٥﴾ اَئِفْكًا اٰلِهَةً دُونَ اللّٰهِ تُرِيدُونَ ﴿٨٦﴾ فَمَا ظَنُّكُمْ بِرَبِّ الْعَالَمِينَ ﴿٨٧﴾

---

**81) (**إِنَّهُ مِنْ عِبَادِنَا الْمُؤْمِنِينَ**) - Həqiqətən, Nuh bizim mömin bəndələrimizdəndir.**

**82) (**ثُمَّ اَغْرَقْنَا الْاٰخَرِينَ**) -** (Ey Məhəmməd), **Nuhun özünə və ailəsinə nicat verəndən sonra onun xalqını bizə asi olduqları üçün suya qərq etdik. Hamısı həlak oldular.**

**83) (**وَاِنَّ مِنْ شِيعَتِهِ لَاِبْرٰهِيمَ**) -** (Ey Məhəmməd) **həqiqətən, dində və Allah-Təalanın din və ehkamını təkzib edənlərin əziyyətinə səbir etmədə Nuhun davamçısı olan İbrahim də Nuh kimi hər bir bəla və əziyyətə səbir edib dözdü.**

**84) (**اِذْ جَآءَ رَبَّهُ بِقَلْبٍ سَلِيمٍ**) - O zaman ki,** (İbrahim) **xəbis sifətlərdən təmiz olan qəlbilə öz rəbbi Allah-Təala tərəfinə gəldi, qəlbində ancaq Allah-Təalaya yer ayırıb, Ondan başqasını qəlbindən çıxartdı.**

**85) (**اِذْ قَالَ لِاَبِيهِ وَقَوْمِهِ مَاذَا تَعْبُدُونَ**) - O zaman ki, (İbrahim ə.s.) dəvətə başladı, əvvəlcə atasını və xalqını dəvət edib onlara dedi: "Nəyə ibadət edirsiniz?"**

**86) (**اَئِفْكًا اٰلِهَةً دُونَ اللّٰهِ تُرِيدُونَ**) - Bəs Allah-Təaladan başqa yalan məbudlar istəyib, onlara ibadət edirsiniz?**

**87) (**فَمَا ظَنُّكُمْ بِرَبِّ الْعَالَمِينَ**) - Aləmləri yetişdirib tərbiyə verən rəbbiniz Allah-Təala haqqında sizin zənn və gümanınız nədir, onu nə hesab edirsiniz ki, belə bütləri ona şərik sayırsınız? Onu da bu bütlər kimi güman edirsiniz? O elə bir əzəli və əbədi varlıqdır ki, heç bir şərikə ehtiyacı yoxdur.** (Cənab İbrahimin (ə.s) camaatı bütpərəst idi. Bir bayram günləri var idi. Həmin bayramda səhraya çıxıb, qurban kəsib eyş-işrətlə məşğul olardılar. Cənab İbrahim ə.s. xalqı imana dəvət etməyə təzə başlayanda o bayram günü başladı. İbrahimi də özlərilə birlikdə səhraya getməyə dəvət etdilər. Cənab İbrahim istədi ki, onlar gedəndən sonra şəhərdə qalıb onların bütlərinə bir zərər yetirsin, ya həqiqətən xəstəliyi, o cümlədən baş ağrısı var idi, ya da ki, xəstəliyi bəhanə edirdi. Gözlərini ulduzlara, göyə tərəf tutub, düşünüb dedi: "Mən naxoşam, sizinlə birlikdə səhraya getməyə halım yoxdur. Necə ki növbəti ayədə Allah-Təala xəbər verir, bəzi təfsirçilər dedilər ki, cənab İbrahim bu sözü yalandan dedi, xəstəlikdən məqsədi guya taun xəstəliyi idi ki, ondan çəkinib, kənar olsunlar. Birincisi haradan məlum olur ki, bu sözü yalandan deyib? Onun özündə xəstəlik varsa nə olar? Necə ki, əvvəlcə də bəhs edil-

فَنَظَرَ نَظْرَةً فِي النُّجُومِ ۙ﴿٨٨﴾ فَقَالَ اِنِّي سَقِيمٌ ﴿٨٩﴾ فَتَوَلَّوْا عَنْهُ مُدْبِرِينَ ﴿٩٠﴾ فَرَاغَ اِلٰىٓ اٰلِهَتِهِمْ
فَقَالَ اَلَا تَاْكُلُونَ ۚ﴿٩١﴾ مَا لَكُمْ لَا تَنْطِقُونَ ﴿٩٢﴾ فَرَاغَ عَلَيْهِمْ ضَرْبًا بِالْيَمِينِ ﴿٩٣﴾ فَاَقْبَلُوٓا اِلَيْهِ
يَزِفُّونَ ﴿٩٤﴾ قَالَ اَتَعْبُدُونَ مَا تَنْحِتُونَ ۙ﴿٩٥﴾ وَاللّٰهُ خَلَقَكُمْ وَمَا تَعْمَلُونَ ﴿٩٦﴾ قَالُوا ابْنُوا لَهُ
بُنْيَانًا فَاَلْقُوهُ فِي الْجَحِيمِ﴿٩٧﴾

---

di. Və ikincisi, əgər xəstəliyi olmasaydı da, elə məqamlarda bu kimi bəhanələr gətirmək yalan sayılmaz. Bəhanə sahibi üzrlüdür).

**88) (فَنَظَرَ نَظْرَةً فِي النُّجُومِ) - Ulduzlara** (göyə tərəf) **nəzər salıb düşündü ki, onlarla səhraya getməkdən xilas olsun. Axırda bədənindəki xəstəlik yadına gəldi.**

**89) (فَقَالَ اِنِّي سَقِيمٌ) - Dedi: "Həqiqətən, mən naxoşam, sizinlə birlikdə səhraya gedə bilmərəm.**

**90) (فَتَوَلَّوْا عَنْهُ مُدْبِرِينَ) - Elə ki cənab İbrahim bu sözü dedi. Camaat ondan üz çevirib, bayramdan ötrü səhraya getdilər.**

**91) (فَرَاغَ اِلٰىٓ اٰلِهَتِهِمْ فَقَالَ اَلَا تَاْكُلُونَ) - Cənab İbrahim gizlincə onların bütlərinə tərəf gedib bütxanaya daxil oldu. (Onların adəti idi, bütlərin qabağına yemək qoyardılar). İbrahim istehzadan ötrü bütlərə dedi: "Niyə yemək yemirsiniz? Yemək yeyin.**

**92) (مَا لَكُمْ لَا تَنْطِقُونَ) - Bütlərdən cavab gəlməyəndə dedi: "Sizə nə olub ki, danışmırsız? Xalq ki, sizə ibadət edir. İndi ki, siz cansız, danışmayan şeylərsiniz, sizi sındırıb dağıtmaq lazımdır, bəlkə sizə ibadət etməyi tərk edələr".**

**93) (فَرَاغَ عَلَيْهِمْ ضَرْبًا بِالْيَمِينِ) - İbrahim gizlincə bir alət götürüb, sağ əli ilə var gücü ilə onlara vurdu. Parça-parça edib sındırıb dağıtdı.**

**94) (فَاَقْبَلُوٓا اِلَيْهِ يَزِفُّونَ)** - (İbrahimin bu əməlini səhrada olanlara xəbər verdilər). **Hamısı qayıdıb sürətlə** (İbrahimə tərəf) **gəldilər,** (dedilər: "Bu nə əməldir ki, edibsən?)

**95) (قَالَ اَتَعْبُدُونَ مَا تَنْحِتُونَ)** - (İbrahim) **dedi:** (siz məni məzəmmət edirsiniz, amma özünüz həya etməyirsiniz), **ibadət edirsiniz o şeylərə ki, özünüz hazırlayıb düzəldibsiniz.** (Ağıllı şəxs belə əməl edərmi?)

**96) (وَاللّٰهُ خَلَقَكُمْ وَمَا تَعْمَلُونَ) - Halbuki sizin özünüzü və düzəldib sitayiş etdiyiniz bu bütləri, onların əsl mahiyyətlərini Allah-Təala yaradıbdır. Sizin onlar üçün şəkil düzəltməniz onları Allah-Təalaya məxluq olmaqdan çıxartmaz. Necə ki, siz məxluq olmaqdan çıxa bilməzsiniz.**

**97) (قَالُوا ابْنُوا لَهُ بُنْيَانًا فَاَلْقُوهُ فِي الْجَحِيمِ) - Elə ki, müşriklər** (cənab İbrahimin)

فَارَادُوا بِهٖ كَيْدًا فَجَعَلْنَاهُمُ الْاَسْفَلٖينَ ﴿٩٨﴾ وَقَالَ اِنّٖي ذَاهِبٌ اِلٰى رَبّٖي سَيَهْدٖينِ ﴿٩٩﴾ رَبِّ هَبْ لٖي مِنَ الصَّالِحٖينَ ﴿١٠٠﴾ فَبَشَّرْنَاهُ بِغُلَامٍ حَلٖيمٍ ﴿١٠١﴾

---

**bu hərəkətini görüb və bu sözləri ondan eşitdilər, bir-biriləri ilə məşvərət edib dedilər: "İbrahimdən ötrü bir yer düzəldib, orada od yandırıb onu odun içinə salın."**

**98) (فَارَادُوا بِهٖ كَيْدًا فَجَعَلْنَاهُمُ الْاَسْفَلٖينَ) -** (İbrahimə) **məkr, hiylə qurub, onu tutub oda saldılar. Biz onları zəlil və zəif edib,** (İbrahimi) **onlara qalib edib, ona oddan nicat verdik.**

**99) (وَقَالَ اِنّٖي ذَاهِبٌ اِلٰى رَبّٖي سَيَهْدٖينِ) - Elə ki, İbrahimə oddan nicat verdik, daha müşriklərin arasında durmayıb, bizim əmr etdiyimiz** (müqəddəs yerə-Şama) **hicrət** (köç) **edib dedi: "Mən öz rəbbim Allah-Təalaya tərəf gedirəm, əlbəttə məni xeyirli olan bir işə hidayət edir.** (Cənab İbrahim Babildən hicrət edib, gedib Şamda yerləşdi).

**100) (رَبِّ هَبْ لٖي مِنَ الصَّالِحٖينَ) - Cənab İbrahim Şamda yerləşəndən sonra dua edib Allah-Təaladan övlad istədi, dedi: "Ey mənim rəbbim, mənə salehlərdən olan bir övlad ver.**

**101) (فَبَشَّرْنَاهُ بِغُلَامٍ حَلٖيمٍ) - (Ey Məhəmməd), İbrahimin duasını qəbul edib onu yumşaq xasiyyətə sahib bir oğulla* müjdələdik.**

(Allah-Təala İsmayılı ona bəxş etməyi müjdələdi). **Elə ki, İsmayıl yetkinləşib kamilləşdi, cənab İbrahim Məkkədə olan zaman yuxuda gördü ki, guya Allah-Təala tərəfindən oğlu İsmayılın boğazının kəsilməsilə** (qurban etmə ilə) **vəzifələndirilib, bu mətləbi İsmayıla bildirdi. İsmayıl təmkinlə itaət edib, boğazını kəsməyə atasını təşviq etdi. Necə ki Allah-Təala ayələrdə xəbər verir).**

*(*Qeyd: "Cənab İbrahimin qurbanlıq edilən oğlu Tövratda İshaq şəklində qeyd olunubdur. Lakin peyğəmbərin səhabələri və islam alimləri arasında bu barədə ixtilaf vardır. Səhabədən Əli ibn Əbu Talib, Ömər ibn Xəttab, İbn Məsud, Abbas ibn Əbdülmüttəlib, onlardan sonra tabeindən Kəb-ül-Əxbar, Sə`d ibn Cübeyir, təfsirçilərdən Qətadə, İkrimə, Ata, Müqatil, Zühri, əs-Süddi, bunlar deyiblər ki, qurbanlıq İshaqdır. İbn Abbas, Abdullah ibn İslam, Həsən Bəsri, Sə`d ibn Müseyyəb, Şə`bi, Mücahid, Rəbi ibn Ənəs, Məhəmməd ibn Kə`b əl-Qurezi, Abdullah ibn Ömər, əl-Kəlbi, bunlar deyiblər ki, qurbanlıq İsmayıldır. Bu ikinci sözün doğru olması həm məntiqlə və həm də rəvayətlərlə zahir və aşkardır. Birincisi, bu hadisə Məkkədə olub, İsmayıl da Məkkədə bilirik ki, olub. İshaq isə Məkkədə olmayıb və heç bir vaxt Məkkəyə getməyib. Tarix bu mətləbə şahiddir. Əsmai deyir: "Mən (Əbu Əmr ibn əl-Əladan) soruş-*

فَلَمَّا بَلَغَ مَعَهُ السَّعْيَ قَالَ يَا بُنَيَّ اِنّٖيٓ اَرٰى فِي الْمَنَامِ اَنّٖيٓ اَذْبَحُكَ فَانْظُرْ مَاذَا تَرٰىۜ قَالَ يَٓا اَبَتِ افْعَلْ
مَا تُؤْمَرُۘ سَتَجِدُنٖيٓ اِنْ شَٓاءَ اللّٰهُ مِنَ الصَّابِرٖينَ ﴿١٠٢﴾ فَلَمَّٓا اَسْلَمَا وَتَلَّهُ لِلْجَبٖينِۚ ﴿١٠٣﴾ وَنَادَيْنَاهُ
اَنْ يَٓا اِبْرٰهٖيمُۙ ﴿١٠٤﴾ قَدْ صَدَّقْتَ الرُّءْيَاۚ

---

*dum: "Görəsən, Allah yolunda qurban edilən İshaqdır, yoxsa İsmayıl? Dedi: "Ağlın niyə çaşıb? Nə vaxt İshaq Məkkədə olub? Məkkədə İsmayıl Beytullahı atası İbrahimlə birlikdə tikib. Bu hadisədə Məkkədə olub. Necə ola bilər ki, o, İshaq olsun və üçüncüsü, surədə bəhs olunan qissə bu mətləbə işarə edir. Çünki qurbanlıq əhvalatını qeyd edib bitirəndən sonra Allah-Təala İshaqın İbrahimə müjdə verməsini göstərib buyurur: "Salehlərdən bir peyğəmbər olaraq İbrahimə İshaqı müjdələdik", necə ki, bundan sonra bəhs olunacaqdır. Əgər qurbanlıq İshaq olsaydı, birinci dəfə yumşaq xasiyyətli bir oğlan ilə müjdələyəndən sonra yenidən müjdə verməyin mənası olmazdı, bu, açıq-aşkar olan bir işdir. Belə bir işdə ki, Qurani-Şərifin ona işarəsi zahir və aşkardır, ixtilaf etmək son dərəcə qəribə işdir və İshaq barəsində imam Əli ibn Əbu Talib və digər səhabədən nəql olunan rəvayətlərin yəhudilər tərəfindən onlara isnad edilməsi şübhəsizdir. Tövratda İsmayıl əvəzinə İshaq adının keçməsi də yəhudi alimlərinin işidir).*

**102) (فَلَمَّا بَلَغَ مَعَهُ السَّعْيَ) - O zaman ki,** (İsmayıl) **atası İbrahimin tərbiyəsi və səyi ilə atasının hər bir iş və ehtiyacı üçün çalışıb yetkinlik və kamillik məqamına çatdı,** (cənab İbrahim o yuxunu gördü).

**(قَالَ يَا بُنَيَّ اِنّٖيٓ اَرٰى فِي الْمَنَامِ اَنّٖيٓ اَذْبَحُكَ فَانْظُرْ مَاذَا تَرٰى) - İbrahim İsmayıla dedi: "Ey mənim oğulcuğazım,** (mehribanlıq məqamında ata oğula deyir), həqiqətən, mən yuxuda gördüm ki, səni Allah-Təaladan ötrü qurban kəsirəm. Oğlum, bu barədə sənin rəyin nədir? Bəs bu əmrə razısanmı?")

**(قَالَ يَٓا اَبَتِ افْعَلْ مَا تُؤْمَرُۘ سَتَجِدُنٖيٓ اِنْ شَٓاءَ اللّٰهُ مِنَ الصَّابِرٖينَ) - Cənab İsmayıl təslim olub dedi: "Ey mənim atam, hər bir şeylə ki, əmr olunubsan, onu da elə. Əlbəttə, inşaallah məni səbir edənlərdən görərsən.** (Allah-Təalanın kamil qüdrəti hər bir şeyi əhatə etdiyinə görə cənab İsmayıl özünün səbir etməyini Allah-Təalanın istəyinə bağladı).

**103) (فَلَمَّٓا اَسْلَمَا وَتَلَّهُ لِلْجَبٖينِۚ) - O zaman ki** (İbrahim və İsmayıl) **hər ikisi İbrahim görən yuxunu dəlil sayıb ona tabe oldular, İbrahim İsmayılı kəsməkdən ötrü onu yanı üstə uzatdı.** (Necə ki, heyvanı kəsəndə uzadırlar), **İsmayılın üzünün və çiyninin bir tərəfi də yerə dəydi.**

**104-105) (وَنَادَيْنَاهُ اَنْ يَٓا اِبْرٰهٖيمُۙ قَدْ صَدَّقْتَ الرُّءْيَاۚ)** - (Ey Məhəmməd), **elə ki, İbrahim oğlu İsmayılın boğazını kəsməyə başladı, onun kəsilməsinə biz razı olmayıb İbrahimə səslənib dedik: "Ey İbrahim, sən gördüyün yuxunu təsdiq edib İsmayılı kəsməyə başladın, lakin bizim tərəfimizdən onun kəsilməsilə məsul deyilsən. Onu kəsməkdən özünü saxla.**

إِنَّا كَذَٰلِكَ نَجْزِي الْمُحْسِنِينَ ﴿١٠٥﴾ إِنَّ هَٰذَا لَهُوَ الْبَلَاءُ الْمُبِينُ ﴿١٠٦﴾ وَفَدَيْنَاهُ بِذِبْحٍ عَظِيمٍ ﴿١٠٧﴾ وَتَرَكْنَا عَلَيْهِ فِي الْآخِرِينَ ﴿١٠٨﴾

---

**(إِنَّا كَذَٰلِكَ نَجْزِي الْمُحْسِنِينَ) -** (Ey **Məhəmməd), həqiqətən, biz yaxşı əməl sahiblərinə belə cəza verib onları məyus olandan sonra fərəh və sevinc aləminə daxil edərik.**

**106) (إِنَّ هَٰذَا لَهُوَ الْبَلَاءُ الْمُبِينُ) - Həqiqətən, İbrahimin bu bəla və dərdi böyük imtahandır ki, bir yuxu səbəbinə** (guya yuxuda bizim tərəfimizdən onun kəsilməsilə məsul olub) **itaət edib oğlunu kəsməyə başladı. İnsanın öz əli ilə oğlunu kəsməsindən böyük bəla olmaz.**

**107) (وَفَدَيْنَاهُ بِذِبْحٍ عَظِيمٍ) - Böyük bir qoçu kəsməyini İsmayılın* kəsilməsilə əvəz etdik. İbrahimə vəhy etdik. İsmayıl kimi oğlunu niyə kəsirsən? Onun əvəzinə bir böyük qoç kəsib ətini də payla.**

*(*__Qeyd:__ "İsmayılın hadisəsi zilhiccə ayının 10-cu günündə olduğu üçün o gündə qurban kəsmək ərəblər arasında adət oldu. Hənif dini olan islam zühur edəndən sonra islam şəriətinin sahibi qurban kəsməkdə bir çox fayda görüb, (hansı ki, bu zamanda o faydaların heç biri biz islam ümməti arasında düşünülmür) həmin gündə qurban kəsməyi əmr etdi. Onu həccin əməllərindən saydı. İslam alimləri, xüsusilə Üsulilər İsmayılın qurban edilmə hadisəsini bir böyük mövzu sayıblar, o barədə səhifələr yazılıb. Bu barədə təxəyyül və təfəkkür edib, bir-biriləri ilə mübahisə ilə məşğul olublar. Görəsən, Allah-Təala İbrahimi İsmayılı qurban etməyə həqiqətən məsul etmişdi? Ya da qurban etməsini əvvəlcə əmr edəndən sonra necə olur ki, bu işi tərk etməyi əmr edib, qurban etməyi qadağan etsin? Hər şəxs öz rəyinin isbatı üçün bir çox dəlillər gətirib, bu mətləbi özləri üçün böyük bir mübahisə açmışlar. Amma həqiqət və insaf üzrə təfəkkür edəndə bunların heç biri Qurani-Şərifə uyğun deyildir. Qurani-Şərifdə elə bir mətləb bəhs olunmayıbdır ki, zehinləri qarışdırıb, ixtilafa səbəb olsun. Həmin surədə bəhs olunan ayələrdən cənab İbrahimə İsmayılı qurban etməyi əmr etməsi görülmür. Allah-Təala uca peyğəmbəri Məhəmmədə (ə.s) bildirir ki, İbrahim belə bir yuxu gördü və o yuxunun məzmununu təsdiq etdi ki, mən bu yuxuya görə Allah-Təala tərəfindən oğlum İsmayılın qurban edilməsi ilə məsulum, elə ki, qurban etməyə başladı, biz ona xitab edib dedik: "Ey İbrahim, bu yuxu ki, sən görübsən, sən özün bu yuxunu təsdiq edib oğlun İsmayılın kəsilməsinə təşəbbüs edibsən, ancaq bizim tərəfimizdən oğlunu qurban etməyə məsul deyilsən. Sən özünü bizim tərəfimizdən İsmayılın qurban edilməsinə məsul saydığın üçün - halbuki elə deyil, səni o işdən geri qaytarmaq bizə vacibdir, oğlun İsmayılı qurban etməyi tərk edib, onun əvəzinə böyük qoç kəsib, onun ətini payla. Ayələrdən çıxan*

سَلَامٌ عَلٰىٓ اِبْرٰهٖيمَ ﴿١٠٩﴾ كَذٰلِكَ نَجْزِي الْمُحْسِنٖينَ ﴿١١٠﴾ اِنَّهُ مِنْ عِبَادِنَا الْمُؤْمِنٖينَ ﴿١١١﴾
وَبَشَّرْنَاهُ بِاِسْحٰقَ نَبِيًّا مِنَ الصَّالِحٖينَ ﴿١١٢﴾ وَبَارَكْنَا عَلَيْهِ وَعَلٰىٓ اِسْحٰقَۜ وَمِنْ ذُرِّيَّتِهِمَا مُحْسِنٌ
وَظَالِمٌ لِنَفْسِهٖ مُبٖينٌ ﴿١١٣﴾

---

*məna budur. Əgər insaf əhli diqqətlə baxıb təfəkkür edib, təqlidi kənara qoysalar bu mətləbin haqlılığı onlara aşkar olar. Quran ayələrinin doğru olan mənası ortada olduğu halda, onlara boş mənalar yükləmək və bu mövzuda mübahisələr etmək heyrət ediləcək bir işdir. Hidayəti verən Allahdır).*

**108) (وَتَرَكْنَا عَلَيْهِ فِي الْاٰخِرٖينَ)** - (Ey Məhəmməd), **İbrahimdən ötrü ondan sonra gələn millətlərin arasında gözəl bir şeyi qərar verdik. O şey budur:**

**109) (سَلَامٌ عَلٰىٓ اِبْرٰهٖيمَ) - Hər bir millət və tayfa İbrahimə salam göndərib onu dost sayırlar.** (Bu kəlamın haqq və doğru olması zahirdir. Hər bir millətin yanında İbrahim sevimli olub onu özlərinə rəhbər sayırlar).

**110) (كَذٰلِكَ نَجْزِي الْمُحْسِنٖينَ) - İbrahimə mükafat verib onu hər bir millətin yanında sevilən edən kimi, hər bir yaxşı əməl sahiblərinə belə mükafat verərik.**

**111) (اِنَّهُ مِنْ عِبَادِنَا الْمُؤْمِنٖينَ) - Həqiqətən, İbrahim bizə iman edən bəndələrimizdəndir.**

**112) (وَبَشَّرْنَاهُ بِاِسْحٰقَ نَبِيًّا مِنَ الصَّالِحٖينَ)** - (Ey Məhəmməd), **İsmayıldan sonra İbrahimə İshaqın peyğəmbər və saleh şəxs olacağı müjdəsini verdik.** (Bu ayə qurbanlığın İsmayıl olmasına dəlildir. Çünki qurbanlıq qissəsi bitəndən sonra İshaqla müjdələmək onun qurbanlıq olmadığına işarə edir.)

**113) (وَبَارَكْنَا عَلَيْهِ وَعَلٰىٓ اِسْحٰقَۜ) - Din və dünya bərəkətlərini İbrahim və İshaqdan ötrü artırdıq. Onlardan həmişə xeyir əməl peyda olub. Heç bir çirkin əməlləri olmayıb (وَمِنْ ذُرِّيَّتِهِمَا مُحْسِنٌ وَظَالِمٌ لِنَفْسِهٖ مُبٖينٌ) Amma onların övladlarının* bəzisi xeyir əməl sahibi, mömin və müvəhhid oldular. Bəzisi isə açıq-aşkar nəfslərinə zülm edib müşrik oldular.**

*(**Qeyd:** "Bu ayə işarə edir ki, yaxşı, yamanlıq soyla meydana gələn iş deyil. Bəzən fasiq (günahkar) şəxsdən nəcib şəxs, nəcibdən fasiq əmələ gəlir, əsl nəcabət şəxsin öz nəfsindən asılıdır. Nəcib və xeyir əməl sahibinin ata-babasının, ya da övladının xəbis, zalım, zındıq olması heç bir eyib deyildir. Necə ki, cənab İbrahimə Azərin ata olması və cənab Məhəmməd ə.s.-a Əbu Ləhəbin əmi olması və digər ata-babasının bütpərəst olması eyib və nöqsan deyil. Allah-Təala yanında şəxsin öz əməlinin xəbis olması ona eyib sayılıb, özünün etdiyi əməllərdən sorğu-sual ediləcəkdir. Bizim islam alimlərindən bir qrup ata-babanın küfr və zülmünü peyğəmbərlər üçün əskiklik sayıb, ayə və hədisləri təhrif edib, peyğəmbərin ata-babasını İbrahimin atası Azərə kimi müvəhhid sayıblar. (və inni ləhum zəlikə)*

وَلَقَدْ مَنَنَّا عَلٰى مُوسٰى وَهٰرُونَ ﴿١١٤﴾ وَنَجَّيْنَاهُمَا وَقَوْمَهُمَا مِنَ الْكَرْبِ الْعَظٖيمِ ﴿١١٥﴾ وَنَصَرْنَاهُمْ
فَكَانُوا هُمُ الْغَالِبٖينَ ﴿١١٦﴾ وَاٰتَيْنَاهُمَا الْكِتَابَ الْمُسْتَبٖينَ ﴿١١٧﴾ وَهَدَيْنَاهُمَا الصِّرَاطَ الْمُسْتَقٖيمَ
﴿١١٨﴾ وَتَرَكْنَا عَلَيْهِمَا فِي الْاٰخِرٖينَ ﴿١١٩﴾ سَلَامٌ عَلٰى مُوسٰى وَهٰرُونَ ﴿١٢٠﴾ اِنَّا كَذٰلِكَ
نَجْزِي الْمُحْسِنٖينَ ﴿١٢١﴾ اِنَّهُمَا مِنْ عِبَادِنَا الْمُؤْمِنٖينَ ﴿١٢٢﴾

---

*Bəs İbrahimdən o tərəfə necə sübut edəcəklər? Halbuki İbrahimdən bu tərəfə də sübut etmək son dərəcə müşkül işdir və həm də İbrahimdən əvvəlki ümmətlərin haqqında varid olan ayələrdən qafil olublar ki, buyurur: "Ad, Səmud camaatından sonra o qədər insan nəsli gətirmişik ki, onların halına və xüsusiyyətinə Allah-Təaladan başqa agah olan olmaz". Allah-Təala Qurani-Şərifdə buyurur: "Mömin şəxsin sifəti odur ki, belə desin: "biz Allah-Təala peyğəmbərlərinin heç birinə fərq qoymayıb, hamısına iman edib, hamısını eyni dərəcədə Allah-Təalanın peyğəmbəri hesab edirik". "Ağıl sahibləri, bundan ibrət alın!")*

**114-115) (وَلَقَدْ مَنَنَّا عَلٰى مُوسٰى وَهٰرُونَ وَنَجَّيْنَاهُمَا وَقَوْمَهُمَا مِنَ الْكَرْبِ الْعَظٖيمِ) -** (Ey Məhəmməd), **həqiqətən biz Musa və Haruna yaxşılıq edib, onlara nemət verib, onları peyğəmbər seçib, özlərini və xalqları olan Bəni-İsraili bir böyük bəla və dərddən (fironun əzabından və suya qərq olmaqdan) xilas etdik.**

**116) (وَنَصَرْنَاهُمْ فَكَانُوا هُمُ الْغَالِبٖينَ) - Musa və Harunun xalqı olan Bəni-İsrailə yardım etdik. Qibtilərə** (Misir əhlinə) **qalib gəldilər.**

**117) (وَاٰتَيْنَاهُمَا الْكِتَابَ الْمُسْتَبٖينَ) - Musa və Haruna bizim hikmətlərimizi gözəl vəchlə bəyan edən kitab (Tövrat) verdik.**

**118) (وَهَدَيْنَاهُمَا الصِّرَاطَ الْمُسْتَقٖيمَ) - Musa və Harunu hər ikisini düz yola** (tövhid yoluna) **hidayət etdik.**

**119) (وَتَرَكْنَا عَلَيْهِمَا فِي الْاٰخِرٖينَ) - Onlardan ötrü özlərindən sonra gələn ümmətlər arasında belə qərar verdik ki,**

**120) (سَلَامٌ عَلٰى مُوسٰى وَهٰرُونَ) - Musa və Haruna salam göndərib onları gözəl sifətlərlə yad edərlər.**

**121) (اِنَّا كَذٰلِكَ نَجْزِي الْمُحْسِنٖينَ) -** (Ey Məhəmməd), **həqiqətən, biz yaxşı əməl sahiblərinə belə mükafat verdik ki, həmişə onu xeyirlə yad etsinlər.**

**122) (اِنَّهُمَا مِنْ عِبَادِنَا الْمُؤْمِنٖينَ) - Həqiqətən, Musa və Harun bizə iman edən* bəndələrimizdən idilər.**

*(***Qeyd:*** "Allah-Təalanın yanında ən yüksək dərəcə bəndəlik (qulluq) mərtəbəsidir və bu səbəbdən peyğəmbərləri peyğəmbərlik sifətilə yad edəndən sonra hidayət tapıb kafir və müşriklərə qalib olmalarını iman sifətilə səbəbləndirib, Allaha qul olmaları ilə əlaqələndirir. Peyğəmbərin şanının ucalığı bən-*

وَاِنَّ اِلْيَاسَ لَمِنَ الْمُرْسَلِينَۜ ﴿١٢٣﴾ اِذْ قَالَ لِقَوْمِه۪ٓ اَلَا تَتَّقُونَ﴿١٢٤﴾ اَتَدْعُونَ بَعْلًا وَتَذَرُونَ اَحْسَنَ
الْخَالِقِينَۙ ﴿١٢٥﴾ اَللّٰهَ رَبَّكُمْ وَرَبَّ اٰبَٓائِكُمُ الْاَوَّلِينَ ﴿١٢٦﴾ فَكَذَّبُوهُ فَاِنَّهُمْ لَمُحْضَرُونَۙ ﴿١٢٧﴾اِلَّا
عِبَادَ اللّٰهِ الْمُخْلَصِينَ ﴿١٢٨﴾ وَتَرَكْنَا عَلَيْهِ فِي الْاٰخِرِينَ ﴿١٢٩﴾ سَلَامٌ عَلٰٓى اِلْ يَاسِينَ ﴿١٣٠﴾ اِنَّا
كَذٰلِكَ نَجْزِي الْمُحْسِنِينَ ﴿١٣١﴾

---

*dəliyinin çoxluğundandır və bu səbəbdən namazın "təşəhhüd"ündə (salam verərkən) Hz. Məhəmmədin peyğəmbərliyinə şəhadət verəndə qulluq mərtəbəsi peyğəmbərlik mərtəbəsindən əvvəl qeyd olunur. Təfəkkür etmək lazımdır).*

**123) (وَاِنَّ اِلْيَاسَ لَمِنَ الْمُرْسَلِينَ) -** (Ey Məhəmməd), **həqiqətən, İlyas bizim tərəfimizdən göndərilən peyğəmbərlərdəndir. Onu öz xalqına peyğəmbər göndərdik.**

**124) (اِذْ قَالَ لِقَوْمِه۪ٓ اَلَا تَتَّقُونَ) - O zaman ki, öz xalqını Allah-Təalanın tərəfinə dəvət edib dedi: "Bəs Allah-Təaladan qorxmursunuz ki, ona şirk qoşursunuz?**

**125) (اَتَدْعُونَ بَعْلًا وَتَذَرُونَ اَحْسَنَ الْخَالِقِينَ) - Bəs Bələ** (Bəl onların bütlərinin adıdı) **dua və ibadət edib, o bütləri yaradıcı saysanız da, hamısından çox qüdrət sahibi olan, yaradıcıların ən yaxşısı olan Allah-Təalanı tərk edirsiniz.**

**126) (اَللّٰهَ رَبَّكُمْ وَرَبَّ اٰبَٓائِكُمُ الْاَوَّلِينَ) - Yaradıcıların ən yaxşısı sizin və keçmiş ata-babalarınızın tərbiyəedici rəbbi olan Allah-Təaladır. Belə Allah-Təalanı qoyub, bütlərə sitayiş etmək ağılsızlıqdır. Bu çirkin əməli tərk edib, yeganə Allah-Təalaya ibadət edin.**

**127) (فَكَذَّبُوهُ فَاِنَّهُمْ لَمُحْضَرُونَ) -** (Ey Məhəmməd), **İlyasın xalqı onu təkzib edib, ona itaət etmədilər. Həqiqətən, qiyamət günündə onlar hamısı Allah-Təalanın hüzurunda hazır olub, İlyası təkzib etdiklərinə görə əzaba düçar olacaqlar.**

**128) (اِلَّا عِبَادَ اللّٰهِ الْمُخْلَصِينَ) - Onlardan ancaq Allah-Təaladan ötrü dinlərini xalis edən bəndələr nicat tapıb, Allah-Təalanın neməti onlara veriləcəkdir.**

**129) (وَتَرَكْنَا عَلَيْهِ فِي الْاٰخِرِينَ) -** (Ey Məhəmməd), **İlyasdan ötrü özündən sonra gələn ümmətlərin arasında bu qərarı verdik ki,**

**130) (سَلَامٌ عَلٰٓى اِلْ يَاسِينَ) - İlyası yad edib deyərlər: "Allah-Təalanın salamı İlyasa olsun."**

**131) (اِنَّا كَذٰلِكَ نَجْزِي الْمُحْسِنِينَ) -** (Ey Məhəmməd), **həqiqətən, biz yaxşı əməl sahiblərinə İlyasa verdiyimiz mükafat kimi mükafat verib onların da adını özlərindən sonra gələn ümmətlər gözəl vəchlə zikr edərlər.**

اِنَّهُ مِنْ عِبَادِنَا الْمُؤْمِنِينَ ﴿١٣٢﴾ وَاِنَّ لُوطًا لَمِنَ الْمُرْسَلِينَ ﴿١٣٣﴾ اِذْ نَجَّيْنَاهُ وَاَهْلَهُ اَجْمَعِينَ
﴿١٣٤﴾ اِلَّا عَجُوزًا فِي الْغَابِرِينَ ﴿١٣٥﴾ ثُمَّ دَمَّرْنَا الْاٰخَرِينَ ﴿١٣٦﴾ وَاِنَّكُمْ لَتَمُرُّونَ عَلَيْهِمْ
مُصْبِحِينَ ﴿١٣٧﴾ وَبِالَّيْلِ اَفَلَا تَعْقِلُونَ ﴿١٣٨﴾وَاِنَّ يُونُسَ لَمِنَ الْمُرْسَلِينَ ﴿١٣٩﴾ اِذْ اَبَقَ اِلَى الْفُلْكِ
الْمَشْحُونِ ﴿١٤٠﴾ فَسَاهَمَ فَكَانَ مِنَ الْمُدْحَضِينَ ﴿١٤١﴾ فَالْتَقَمَهُ الْحُوتُ وَهُوَ مُلِيمٌ﴿١٤٢﴾

---

**132) (اِنَّهُ مِنْ عِبَادِنَا الْمُؤْمِنِينَ ) - Həqiqətən, İlyas bizim mömin bəndələrimizdən idi.**

**133) (وَاِنَّ لُوطًا لَمِنَ الْمُرْسَلِينَ) -** (Ey Məhəmməd), **həqiqətən, Lut** (Harran oğlu) **bizim tərəfimizdən xalqı dəvət etməyə göndərilən peyğəmbərlərdən bir idi.**

**134) (اِذْ نَجَّيْنَاهُ وَاَهْلَهُ اَجْمَعِينَ) - O zaman ki, onun xalqına xəbis** (livata - homoseksuallıq) **əməlinə görə əzab göndərdik, onun özünə və ailəsinə nicat verdik.**

**135) (اِلَّا عَجُوزًا فِي الْغَابِرِينَ) Ancaq onun xanımı kafirlərlə əzab içində qalib həlak oldu.**

**136) (ثُمَّ دَمَّرْنَا الْاٰخَرِينَ) - Lutun özünə və ailəsinə nicat verəndən sonra digərlərini həlak etdik.**

**137-138) (وَاِنَّكُمْ لَتَمُرُّونَ عَلَيْهِمْ مُصْبِحِينَ وَبِالَّيْلِ اَفَلَا تَعْقِلُونَ) - Ey Məkkə əhli, siz Şama ticarətə gedib-gələndə gecə və gündüz onların məkanlarından keçib bizim əzabımızın izlərini düşünürsünüz. Bəs təfəkkür edib, dərk etmirsiniz ki, Allah-Təala hər bir şeyə qadirdir?**

**139) (وَاِنَّ يُونُسَ لَمِنَ الْمُرْسَلِينَ) - (Ey Məhəmməd), həqiqətən, (Yunis) bizim tərəfimizdən xalqı haqq tərəfinə dəvət etməyə göndərilən peyğəmbərlərdən biri idi.**

**140) (اِذْ اَبَقَ اِلَى الْفُلْكِ الْمَشْحُونِ) - O zaman ki, xalqından qaçıb, gedib dolu bir gəmiyə daxil oldu.** (Cənab Yunis öz xalqına Allah-Təala tərəfindən əzab vədi verdi. Elə ki, əzabın izləri zahir oldu, xalqı tövbə etdi. Yunis onların arasından qaçıb getdi. Müsafirlərlə dolu gəmiyə daxil oldu).

**141) (فَسَاهَمَ فَكَانَ مِنَ الْمُدْحَضِينَ ) - Elə ki, Yunis gəmiyə mindi, gəmi təlatümə düşüb hərəkətsiz qaldı, gəmiçilərin etiqadı bu idi ki, gəmidə qaçaq, günahkar şəxs olarsa, gəmi hərəkət etməz), püşk atdılar ki, görəsən, günahkar şəxs kimdir? Püşk Yunisə düşdü, o, məğlub və zəlil olub xəcalətin çoxluğundan özünü suya atdı. (Ya da ki, gəmiçilər onu suya atdılar).**

**142) (فَالْتَقَمَهُ الْحُوتُ وَهُوَ مُلِيمٌ) - Dənizə düşən kimi balıq onu uddu. Özü də xalqının arasından qaçdığına görə peşman olub, məzəmmətə layiq idi.**

فَلَوْلَآ اَنَّهُ كَانَ مِنَ الْمُسَبِّح۪ينَۙ ﴿١٤٣﴾ لَلَبِثَ ف۪ي بَطْنِه۪ٓ اِلٰى يَوْمِ يُبْعَثُونَ ﴿١٤٤﴾ فَنَبَذْنَاهُ بِالْعَرَآءِ وَهُوَ
سَق۪يمٌۚ ﴿١٤٥﴾ وَاَنْبَتْنَا عَلَيْهِ شَجَرَةً مِنْ يَقْط۪ينٍۚ ﴿١٤٦﴾ وَاَرْسَلْنَاهُ اِلٰى مِائَةِ اَلْفٍ اَوْ يَز۪يدُونَۚ ﴿١٤٧﴾
فَاٰمَنُوا فَمَتَّعْنَاهُمْ اِلٰى ح۪ينٍۜ ﴿١٤٨﴾ فَاسْتَفْتِهِمْ اَلِرَبِّكَ الْبَنَاتُ وَلَهُمُ الْبَنُونَۙ ﴿١٤٩﴾

---

**143) (فَلَوْلَآ اَنَّهُ كَانَ مِنَ الْمُسَبِّح۪ينَ) -** (Ey Məhəmməd), **əgər Yunis balığın qarnında bizi zikr etməyib, ucalığımızı və qüsursuzluğumuzu yad etməsəydi,** (yəni Ənbiya surəsində qeyd olunan kəlamı “La ilahə illa əntə sübhanəkə inni küntü minəz-zalimin” deməsəydi),

**144) (لَلَبِثَ ف۪ي بَطْنِه۪ٓ اِلٰى يَوْمِ يُبْعَثُونَ) - Hər halda əlbəttə balığın qarnında qiyamətə kimi qalıb, ora onun üçün qəbir olardı. (Balığın qarnında qiyamətə kimi qalmaq, oradan çıxmayıb, ölməyə simvolik işarədir).**

**145) (فَنَبَذْنَاهُ بِالْعَرَآءِ وَهُوَ سَق۪يمٌ) -** (Ey Məhəmməd), **bizim iradəmiz** (Yunisin) **balığın qarnından çıxmasına razı olub, balığın qarnında qalmaq səbəbindən xəstə olduğu üçün ot və su olmayan bir səhraya onu atdıq.**

**146) (وَاَنْبَتْنَا عَلَيْهِ شَجَرَةً مِنْ يَقْط۪ينٍ) - Lütf və rəhmətimiz Yunisə aid olub həmin boş səhrada ondan ötrü bir balqabaq tağı göyərtdik ki, onun kölgəsində rahat olub, bədəni günəşin hərarətindən qorunsun. (Balqabaq tağı tikanlı olduğu üçün ona milçək qonmaz. Yunisin bədəni balığın qarnında xəstə olduğu üçün Allah-Təala balqabaq tağını ona kölgə verən təyin etdi ki, milçəyin əziyyətindən xilas olsun. Yunisin balıq qarnında qalmaq müddəti və xüsusiyyəti haqqında müxtəlif xəbərlər, rəvayətlər nəql olunub. Heç birinə etimad etmək olmaz. Ancaq Allah-Təalanın Qurani-Şərifdə xəbər verdiyi kimi, necə ki, deyir - balıq onu udub, sonra oradan çıxmağına gərək etiqad edək.**

**147) (وَاَرْسَلْنَاهُ اِلٰى مِائَةِ اَلْفٍ اَوْ يَز۪يدُونَ) -** (Ey Məhəmməd), **Yunisə dənizdən nicat verəndən sonra onu bir camaata (Neynəva camaatına) - hansı ki, onlara baxan deyərdi: “100 min nəfərdirlər və ya 100 min nəfərdən artıqdırlar -peyğəmbər göndərdik. “**

**148) (فَاٰمَنُوا فَمَتَّعْنَاهُمْ اِلٰى ح۪ينٍ) - Yunis gedib onları dəvət etdi. Hamısı imana gəldilər. Biz də onların əcəlləri tamam olana kimi dünyada onlara ləzzət verdik. Xoş vəchlə güzəran keçirib, vaxtları bitəndə bizim yanımıza qayıtdılar.**

**149) (فَاسْتَفْتِهِمْ اَلِرَبِّكَ الْبَنَاتُ وَلَهُمُ الْبَنُونَ) -** (Ey Məhəmməd), **müşriklər peyğəmbərlərin əhvalatına baxıb ibrət almayıb, Allah-Təalanın tövhidinə tabe olmurlar. Çirkin şeyləri Allah-Təalaya isnad edirlər. Onlardan soruş ki, bəs sənin rəbbin Allah-Təaladan ötrü qızlar və onlardan ötrü oğlanlar vardır? Necə ki, deyirlər: “Oğul bizim, qız Allah-Təalanındır.** (Ərəblər

اَمْ خَلَقْنَا الْمَلٰئِكَةَ اِنَاثًا وَهُمْ شَاهِدُونَ﴿١٥٠﴾ اَلَٓا اِنَّهُمْ مِنْ اِفْكِهِمْ لَيَقُولُونَ ﴿١٥١﴾ وَلَدَ اللّٰهُ وَاِنَّهُمْ لَكَاذِبُونَ﴿١٥٢﴾ اَصْطَفَى الْبَنَاتِ عَلَى الْبَنٖينَ ﴿١٥٣﴾مَا لَكُمْ كَيْفَ تَحْكُمُونَ ﴿١٥٤﴾ اَفَلَا تَذَكَّرُونَ ﴿١٥٥﴾ اَمْ لَكُمْ سُلْطَانٌ مُبٖينٌ ﴿١٥٦﴾ فَأْتُوا بِكِتَابِكُمْ اِنْ كُنْتُمْ صَادِقٖينَ ﴿١٥٧﴾ وَجَعَلُوا بَيْنَهُ وَبَيْنَ الْجِنَّةِ نَسَبًا

---

qızlara son dərəcə pis baxırdılar. Deyirdilər ki, mələklər qızdır, onlar Allah-Təalanın, oğlanlar bizimdir və bu səbəbdən ərəblərin başçıları qızlarını qətl edirdilər).

**150)** (اَمْ خَلَقْنَا الْمَلٰئِكَةَ اِنَاثًا وَهُمْ شَاهِدُونَ) **-** (Ey Məhəmməd), **görəsən, biz mələikəni yaradanda müşriklər orada idilər, baxıb görürdülər ki, biz mələikəni dişi yaratdıq? Bəlkə ona görə deyirlər ki, mələikə Allah-Təalanın qızlarıdır?**

**151-152)** (اَلَٓا اِنَّهُمْ مِنْ اِفْكِهِمْ لَيَقُولُونَ وَلَدَ اللّٰهُ وَاِنَّهُمْ لَكَاذِبُونَ ) **-** (Ey **Məhəmməd), xəbərdar ol. Həqiqətən, müşriklərin böyük yalan və böhtanlarından biri budur ki, deyirlər: "Allah-Təalanın övladı olubdur".** (Ey Məhəmməd), **həqiqətən, onlar bu sözlərində yalançıdırlar. Allah-Təalanın övladı yoxdur.**

**153)** (اَصْطَفَى الْبَنَاتِ عَلَى الْبَنٖينَ) **- Birincisi, Allah-Təalanın nə oğlu, nə də qız övladı yoxdur və ikincisi, övlad olanda necə olubdur ki, qızı oğula üstün sayıb, oğulu sizə verib, qızı özündən ötrü saxlayıbdır? Əgər oğul qızdan yaxşıdırsa, nədən ötrü oğulu sizə verib qızı özü götürür? (Yaxşını özünüz götürüb, yamanı Allah-Təalaya verirsiniz? Belə axmaq sözləri tərk etməzsinizmi?**

**154)** (مَا لَكُمْ كَيْفَ تَحْكُمُونَ) **- Ey müşriklər, nə olubdur sizə ki, belə fəsad hökmlər verirsiniz?**

**155)** (اَفَلَا تَذَكَّرُونَ) **- Bəs xatırlayıb, qəflət yuxusundan oyanmazsınızmı ki, belə xəbis sözləri tərk edəsiniz?**

**156)** (اَمْ لَكُمْ سُلْطَانٌ مُبٖينٌ) **- Ey müşriklər, bəs mələklərin bizim qızımız olması haqqında sizin zahir və aşkar, bir kağızda qeyd olunan dəliliniz varmı?**

**157)** (فَأْتُوا بِكِتَابِكُمْ اِنْ كُنْتُمْ صَادِقٖينَ) **- Əgər doğru deyənsinizsə, o kağız ki, onda dəliliniz yazılıb qeyd olunubdur, o kağızınızı gətirin,** (ta ki, sizin – mələklərin bizim qızımız olması iddianızın doğru olması məlum olsun).

**158)** (وَجَعَلُوا بَيْنَهُ وَبَيْنَ الْجِنَّةِ نَسَبًا) **-** (Ey Məhəmməd), **bu Qüreyş camaatından olan müşriklərin səfehliyinə bax ki, biz Allah-Təala ilə mələikə arasında soy əlaqəsi isnad edib, mələikəni bizə isnad edib, qız sayırlar.**

وَلَقَدْ عَلِمَتِ الْجِنَّةُ اِنَّهُمْ لَمُحْضَرُونَ ﴿١٥٨﴾ سُبْحَانَ اللّٰهِ عَمَّا يَصِفُونَ ﴿١٥٩﴾ اِلَّا عِبَادَ اللّٰهِ
الْمُخْلَصِينَ ﴿١٦٠﴾ فَاِنَّكُمْ وَمَا تَعْبُدُونَ ﴿١٦١﴾ مَٓا اَنْتُمْ عَلَيْهِ بِفَاتِنِينَ ﴿١٦٢﴾ اِلَّا مَنْ هُوَ صَالِ
الْجَحِيمِ﴿١٦٣﴾ وَمَا مِنَّٓا اِلَّا لَهُ مَقَامٌ مَعْلُومٌ ﴿١٦٤﴾ وَاِنَّا لَنَحْنُ الصَّٓافُّونَ ﴿١٦٥﴾ وَاِنَّا لَنَحْنُ
الْمُسَبِّحُونَ ﴿١٦٦﴾ وَاِنْ كَانُوا لَيَقُولُونَ ﴿١٦٧﴾ لَوْ اَنَّ عِنْدَنَا ذِكْرًا مِنَ الْاَوَّلِينَ ﴿١٦٨﴾ لَكُنَّا
عِبَادَ اللّٰهِ الْمُخْلَصِينَ﴿١٦٩﴾

---

(***Qeyd:** "Ayədə cindən məqsəd məlaikədir. Məlaikə gözlərə görünmədiyi üçün onlara cin deyilir, məlaikəyə cin deyilirsə, bizim xəyal gücümüzlə yaratdığımız cinlərin də əsli yoxdur, təfəkkür etmək lazımdır).

**(وَلَقَدْ عَلِمَتِ الْجِنَّةُ اِنَّهُمْ لَمُحْضَرُونَ) - və halbuki mələklər özləri agahdırlar ki, müşriklər bu sözlərində yalançı olub və qiyamət günündə də cəhənnəmdə hazır olacaqlar.**

**159) (سُبْحَانَ اللّٰهِ عَمَّا يَصِفُونَ) - Müşriklərin ona aid etdiyi sözlərdən Allah-Təala pak və qüsursuzdur.**

**160) (اِلَّا عِبَادَ اللّٰهِ الْمُخْلَصِينَ) - Müşriklərin hamısı cəhənnəmə gedəcək, ancaq Allah-Təaladan ötrü din və imanlarını ixlaslı edən bəndələri nicat tapıb cənnətə daxil olacaqlar.**

**161-162-163) (فَاِنَّكُمْ وَمَا تَعْبُدُونَ مَٓا اَنْتُمْ عَلَيْهِ بِفَاتِنِينَ اِلَّا مَنْ هُوَ صَالِ الْجَحِيمِ) - Ey müşriklər, siz və ibadət etdiyiniz bütləriniz heç bir şəxsi Allah-Təalanın ziddinə olaraq fitnə və zəlalətə salmağa qadir deyilsiniz. Ancaq öz xəbisliklərinə görə cəhənnəm oduna daxil olan şəxsləri zəlalətlərində sabit və bərqərar edərsiniz.**

**164) (وَمَا مِنَّٓا اِلَّا لَهُ مَقَامٌ مَعْلُومٌ) - Siz insanlar təkəbbürünüzdən bizə ibadət etməyib, məlaikəni qız sayırsınız? Amma mələklərin hər biri öz məqam və dərəcələrinə agah olub belə deyərlər: "Biz mələklərdən heç kim yoxdur ki, ondan ötrü ibadət və bəndəlikdə müəyyən bir məqam olmasın, o həddi aşa bilmərik."**

**165) (وَاِنَّا لَنَحْنُ الصَّٓافُّونَ) - Və həqiqətən, biz səf-səf durub, Allah-Təalanın hüzurunda ibadət edənik.**

**166) (وَاِنَّا لَنَحْنُ الْمُسَبِّحُونَ) - Və həqiqətən, Allah-Təalanı hər bir eyib və nöqsandan pak və müqəddəs sayan bizik".**

**167-168-169) (وَاِنْ كَانُوا لَيَقُولُونَ لَوْ اَنَّ عِنْدَنَا ذِكْرًا مِنَ الْاَوَّلِينَ لَكُنَّا عِبَادَ اللّٰهِ الْمُخْلَصِينَ) - (Ey Məhəmməd), hərçənd müşriklər sən peyğəmbər olmadan əvvəl deyirdilər: "Əgər əvvəlki kitablardan bizim yanımızda bir kitab olsaydı,**

فَكَفَرُوا بِهٖ فَسَوْفَ يَعْلَمُونَ ﴿١٧٠﴾ وَلَقَدْ سَبَقَتْ كَلِمَتُنَا لِعِبَادِنَا الْمُرْسَلِينَ ﴿١٧١﴾ اِنَّهُمْ لَهُمُ
الْمَنْصُورُونَ ﴿١٧٢﴾ وَاِنَّ جُنْدَنَا لَهُمُ الْغَالِبُونَ ﴿١٧٣﴾ فَتَوَلَّ عَنْهُمْ حَتّٰى حِينٍ ﴿١٧٤﴾
وَاَبْصِرْهُمْ فَسَوْفَ يُبْصِرُونَ ﴿١٧٥﴾ اَفَبِعَذَابِنَا يَسْتَعْجِلُونَ ﴿١٧٦﴾ فَاِذَا نَزَلَ بِسَاحَتِهِمْ فَسَٓاءَ صَبَاحُ
الْمُنْذَرِينَ ﴿١٧٧﴾

---

**(necə ki yəhudi və xristianların var) biz onlar kimi kafir olmayıb, əlbəttə, Allah-Təalanın xalis bəndələri olardıq, kafirlər belə söyləyirdilər.**

**170) (فَكَفَرُوا بِهٖ فَسَوْفَ يَعْلَمُونَ) - Amma elə ki,** (Ey Məhəmməd), **sən peyğəmbər olub, Quran kimi bir kitabı onlara gətirdin, ona kafir olub itaət etmədilər. Əlbəttə, kafir olduqları üçün onlara necə bir şiddətli əzab veriləcəyinə agah olacaqlar. O vaxt onlara heç bir fayda olmayacaqdır.**

**171) (وَلَقَدْ سَبَقَتْ كَلِمَتُنَا لِعِبَادِنَا الْمُرْسَلِينَ اِنَّهُمْ لَهُمُ الْمَنْصُورُونَ وَاِنَّ جُنْدَنَا لَهُمُ الْغَالِبُونَ) -** (Ey Məhəmməd), **həqiqətən bizim hökmümüz əzəli elmimizdə bizim tərəfimizdən göndərilən peyğəmbərlərin haqqında belə olubdur ki, onlar və onlara tabe olan** (möminlər) **bizim qoşunlarımız əlbəttə, bizim tərəfimizdən olan yardımla düşmənlərimizə qalib gələcəklər.** (Ey Məhəmməd), **sən də müşriklərin əziyyətinə səbir et, axırda onlara qalib olacaqsınız.**

**174) (فَتَوَلَّ عَنْهُمْ حَتّٰى حِينٍ) -** (Ey Məhəmməd) **bir müəyyən zamana kimi bu müşriklərdən üz çevirib, onların əziyyət və töhmətlərinə səbir edib, hər bir çirkin sözlərinə döz. Elə ki, o zaman yetişdi, səni onlara qalib edərik.** (Allahın Rəsulu Allah-Təalanın fərmanına itaət edib səbir etdi. Ta ki, Allah-Təalanın vədi yetişib Bədir savaşı günü hazır oldu. Müsəlmanların ilk savaşında peyğəmbərini müşriklərə qalib edib, onları pərişan etdi).

**175) (وَاَبْصِرْهُمْ فَسَوْفَ يُبْصِرُونَ) -** (Ey Məhəmməd), **ogünkü gündə** (Bədir günündə) **onlara gələn əzaba bax, gör ki, Allah-Təala onları necə zəlil edir? Əlbəttə onlar özləri də o əzabı görəcəklər.** (Elə ki, Allahın Rəsulu bu ayəni müşriklərə oxudu, onlar istehza edib dedilər: (Ey Məhəmməd), bu əzab nə vaxt olacaqdır? Əgər doğru deyirsənsə, o əzabı tez göndər. Allah-Təala onların cavabında bu ayəni göndərdi).

**176) (اَفَبِعَذَابِنَا يَسْتَعْجِلُونَ) -** (Ey Məhəmməd), **bəs müşriklər bizim əzabımızı tez istəyirlər? Guya bizim əzabımızı inkar edirlər.**

**177) (فَاِذَا نَزَلَ بِسَاحَتِهِمْ فَسَٓاءَ صَبَاحُ الْمُنْذَرِينَ) -** (Ey Məhəmməd), **o zaman ki, bizim əzabımız onlara gələr, o vaxt qorxuldulduqları əzabdan çəkinməyən**

وَتَوَلَّ عَنْهُمْ حَتَّى حِينٍ ﴿١٧٨﴾ وَأَبْصِرْ فَسَوْفَ يُبْصِرُونَ ﴿١٧٩﴾ سُبْحَانَ رَبِّكَ رَبِّ الْعِزَّةِ عَمَّا يَصِفُونَ ﴿١٨٠﴾ وَسَلَامٌ عَلَى الْمُرْسَلِينَ ﴿١٨١﴾ وَالْحَمْدُ لِلَّهِ رَبِّ الْعَالَمِينَ ﴿١٨٢﴾

---

**şəxslərin sabahı nə yaman olacaqdır?** (Ərəb tayfalarının arasında bir-birlərinin üstünə qarət hücumu etmək adət idi. Çox vaxt səhər vaxtı qəflətən hücum edərdilər. Əgər o camaatdan bir nəfər onlara desəydi ki, sizin tərəfə düşmən gəlib, qarət edəcək, o camaat o şəxsin sözünə qulaq verməyib, düşməni dəf etmək üçün heç bir tədarük görməsəydilər, səhər qəflətən qarətə məruz qaldıqlarında halları son dərəcə yaman olardı. Allahın Rəsulu müşrikləri Allah-Təalanın əzabından qorxutssa da, onlar tövbə etməyib, əzabı özlərindən dəf etməyə hazır olmadılar. Allah-Təala onlara qəfil əzab göndərəndə onların halını az əvvəl bəhs olunan camaatın halına oxşadır).

**178-179 (وَتَوَلَّ عَنْهُمْ حَتَّى حِينٍ وَأَبْصِرْ فَسَوْفَ يُبْصِرُونَ) -** (Allahın Rəsuluna yenidən təsəlli vermək üçün bu ayəni təkrar edir), **buyurur:** (Ey Məhəmməd), **müşriklərdən üz çevirib, əziyyətlərinə səbir et, müəyyən bir zamana qədər** (Bədir gününə kimi), **o gündə onlara gələn əzabı görərsən, onlar da əlbəttə, görərlər. Hərçənd indi inkar edirlər.**

**180 (سُبْحَانَ رَبِّكَ رَبِّ الْعِزَّةِ عَمَّا يَصِفُونَ) -** (Ey Məhəmməd), **sənin rəbbin Allah-Təala qüdrət və qələbə sahibidir, müşriklərin onu vəsf etdiyi sifətlərdən pak və qüsursuzdur. O sifətlərin heç biri ona layiq deyildir.**

**181 (وَسَلَامٌ عَلَى الْمُرْسَلِينَ) - Bizim tərəfimizdən göndərilən peyğəmbərlərə salamımız olsun.**

**182 (وَالْحَمْدُ لِلَّهِ رَبِّ الْعَالَمِينَ)** - (Ey Məhəmməd), **həmd-səna aləmlərin tərbiyə verən rəbbi Allah-Təalaya məxsus və layiqdir. Gərək hər bir məqamda ona həmd-səna edilsin. (Biz də deyirik: "Allaha həmd olsun. (əs-Saffat) surəsinin təfsiri bitdi. Nə gözəl öyüd-nəsihətlərdir. Xüsusən düşməndən üz çevirib, əfv etməyə aid olan bir surədir. Qurani-Şərifin hər bir ayəsində təfəkkür etmək lazımdır. Əli ə.s. buyurubdur: "Kim istəsə qiyamət günü onun savab və mükafatı çox olsun, gərək məclisdən çıxanda axırıncı kəlamı bu müqəddəs ayələr olsun".**

**Allahın Rəsulu buyurubdur: "Hər bir şəxs əs-Saffat surəsini oxusa, Allah-Təala ona on savab bəxş edər."**

## SAD SURƏSİ

38-ci surədir, Məkkədə nazil olub, 86 ayə, 732 kəlmə və 3067 hərfdir.

صٓ وَالْقُرْاٰنِ ذِي الذِّكْرِۜ ﴿١﴾ بَلِ الَّذٖينَ كَفَرُوا فٖي عِزَّةٍ وَشِقَاقٍ ﴿٢﴾ كَمْ اَهْلَكْنَا مِنْ قَبْلِهِمْ مِنْ
قَرْنٍ فَنَادَوْا وَلَاتَ حٖينَ مَنَاصٍ﴿٣﴾ وَعَجِبُوٓا اَنْ جَٓاءَهُمْ مُنْذِرٌ مِنْهُمْۘ وَقَالَ الْكَافِرُونَ هٰذَا سَاحِرٌ
كَذَّابٌۚ ﴿٤﴾ اَجَعَلَ الْاٰلِهَةَ اِلٰهًا وَاحِدًاۚ اِنَّ هٰذَا لَشَيْءٌ عُجَابٌ﴿٥﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (صٓ) - Bu surənin adıdır.**

**2) (وَالْقُرْاٰنِ ذِي الذِّكْرِۜ) -** (Ey Məhəmməd), **and olsun şöhrət və şərəf sahibi olan bu Qurani-Şərifə ki, ərəb tayfalarını aciz qoyan bu** (صٓ) **surəsidir. Ərəb tayfalarından heç kim fəsahət və bəlağətdə bu surənin müqabilində bir kəlam gətirməyə qüdrət sahibi olmaz. (Əgər müşriklərdən ötrü mümkün olsaydı, bir kəlam gətirib Quranı batil edərdilər və elə bu səbəbdən Quranın möcüzə olmağı aydın və aşkar olub, onu inkar etmək layiq deyildir. (بَلِ الَّذٖينَ كَفَرُوا فٖي عِزَّةٍ وَشِقَاقٍ) - Əksinə kafir və müşriklər Quranın haqlılığını və möcüzə olmağını təkəbbürlərindən və peyğəmbərimiz** (Məhəmməd) **ilə olan ədavətləri səbəbi ilə təsdiq etmirlər.**

**3) (كَمْ اَهْلَكْنَا مِنْ قَبْلِهِمْ مِنْ قَرْنٍ فَنَادَوْا) -** (Ey Məhəmməd), **müşriklər haqdan üz çevirib, itaət etmirlər. Onlardan sənə heç bir zərər gəlməz.**

**Onlardan əvvəl yaşayan bir çox ümmətlər də onlar kimi bizə asi olub hamısı həlak olan anda nalə və fəryad ediblər ki, bəlkə əzabdan xilas olsunlar. (وَلَاتَ حٖينَ مَنَاصٍ) Və halbuki əzab gələndə nicat mümkün olmayıb, onların nalə və fəryad etmələri heç bir fayda vermədi. Hamısı həlak oldular.**

**4) (وَعَجِبُوٓا اَنْ جَٓاءَهُمْ مُنْذِرٌ مِنْهُمْ) - Onların özlərindən onlara bir qorxudan** (peyğəmbər) **gəlməsinə təəccüb edib, qəbul etmədilər. (وَقَالَ الْكَافِرُونَ هٰذَا سَاحِرٌ كَذَّابٌ) - Kafirlər dedilər: "Bu şəxs peyğəmbər deyil, bəlkə yalançı və sehrbaz şəxsdir.** (Necə ki, ey Məhəmməd, səni inkar edib, sehrbaz və kafir deyirlər). **Peyğəmbərlər səbir etdilər, axırda onları kafirlərə qalib etdim. Sən də səbir et. Səni də bu müşriklərə qalib edəcəyəm).**

**5) (اَجَعَلَ الْاٰلِهَةَ اِلٰهًا وَاحِدًاۚ اِنَّ هٰذَا لَشَيْءٌ عُجَابٌ) -** (Ey Məhəmməd), **bu Qüreyş camaatı da əvvəlkilər kimi təəccüb edib dedilər: "Bəs bu rəvadır**

وَانْطَلَقَ الْمَلَأُ مِنْهُمْ اَنِ امْشُوا وَاصْبِرُوا عَلٰىٓ اٰلِهَتِكُمْ ۚ اِنَّ هٰذَا لَشَيْءٌ يُرَادُ ۚ ﴿٦﴾ مَا سَمِعْنَا بِهٰذَا فِي الْمِلَّةِ الْاٰخِرَةِ ۚ اِنْ هٰذَآ اِلَّا اخْتِلَاقٌ ۚ ﴿٧﴾ ءَاُنْزِلَ عَلَيْهِ الذِّكْرُ مِنْ بَيْنِنَا

---

**ki,** (Məhəmməd) **gəlib bizim çoxlu tanrılarımızı bircə tanrı edib, bizi yeganə olan Allah-Təalanın ibadətinə əmr etsin?Həqiqətən, bu əmr çox təəccüblü şeydir. (Ömər ibn Xəttab islama daxil olanların 50-cisidir. Elə ki, islama daxil oldu, möminlər onun islama daxil olmağından şad oldu, Qüreyş camaatına isə onun müsəlman olması çox ağır gəldi. 25 nəfər onların böyüklərindən cəm olub Əbu Talibin yanına getdilər. Dedilər: "Ey Əbu Talib, sən bizim şeyximiz və böyüyümüzsən, bilirsən ki, bu səfehlər** (islama daxil olanlar) **nə işlər görüb, bizə nə əziyyət verirlər. İndi gəlmişik, bizimlə qardaşın oğlu Məhəmməd arasında hökm edəsən. Əbu Talib peyğəmbəri çağırtdırdı.**

**Dedi: "Qardaş oğlu, bunlar sənin xalqın və camaatındır. Sənə bir sualları var. Xahiş edirəm, onlara zərər verməyib, yaxşı cavab verəsən". O cənab buyurdular: "Nə soruşurlar"? Qüreyş camaatı dedilər: "Bizi və bütlərimizi tərk edib, bizdən əl çək. Biz də səni öz məbudunla baş-başa qoyaq". Allahın Rəsulu buyurdu: "Mənə deyin görüm, əgər mən sizin təklifinizi qəbul etsəm, siz də mənim təklifimi qəbul edib, mənə bir söz verəcəksinizmi? Hansı ki, o kəlmənin səbəbinə cəmi ərəb tayfalarına sahib olub, iranlılar da sizin qarşınızda zəlil olacaqlar". Onların arasından Əbu Cəhl dedi: "O kəlməni və onunla birlikdə on kəlmə də verəcəyik." Allahın Rəsulu buyurdu: "O kəlmə budur ki, tövhidə tabe olub, "La ilahə illəllah" deyin". Bu sözdən üz döndərib, keçən ayənin məzmununu (necə ki, Allah-Təala xəbər verdi) dedilər: "Bəs belə olar ki, bütləri tərk edib hamısını bir məbudla əvəz etsin, bu çox təəccüblü işdir.**

**6)** (وَانْطَلَقَ الْمَلَأُ مِنْهُمْ اَنِ امْشُوا وَاصْبِرُوا عَلٰىٓ اٰلِهَتِكُمْ ۚ اِنَّ هٰذَا لَشَيْءٌ يُرَادُ) **- Qüreyşin böyükləri (Əbu Talibin) məclisindən ayrılanda yol əsnasında bir-birilərinə deyirdilər: "Gedin öz məbudunuzun ibadətinə davam edib, Məhəmmədin sözlərinə qulaq asmayın. Məhəmmədin istəyi bizi o dinə daxil etməkdir. Ata-baba dininizdə durub əbədiyyən onun dininə daxil olmayın."**

**7)** (مَا سَمِعْنَا بِهٰذَا فِي الْمِلَّةِ الْاٰخِرَةِ ۚ اِنْ هٰذَآ اِلَّا اخْتِلَاقٌ) **-** (Bu Məhəmmədin) **dediyi sözü** (tövhidi) **son gördüyümüz millətdən** (ata-babamızdan) **eşitməmişik ki, belə bir din onların arasında olmuş olsun. Bu** (Məhəmməd) **deyən söz yalan və iftiradan başqa bir şey deyildir.** (Təqlid insanı həmişə zəlalətə salıbdır. Bax gör ki, ata-babalarını təqlid etmək səbəbi ilə zəlalətdə qalıb, cəhalət pərdəsi onların gözlərini tutub, kor olub, küfr və şirk vadisində çaşqın və sərgərdan qaldılar).

**8)** (ءَاُنْزِلَ عَلَيْهِ الذِّكْرُ مِنْ بَيْنِنَا) **-** (Ey Məhəmməd), **həsəd odu bu müşriklərin**

بَلْ هُمْ فِي شَكٍّ مِنْ ذِكْر۪يۚ بَلْ لَمَّا يَذُوقُوا عَذَابِط﴿٨﴾ اَمْ عِنْدَهُمْ خَزَٓائِنُ رَحْمَةِ رَبِّكَ الْعَز۪يزِ
الْوَهَّابِۚ ﴿٩﴾ اَمْ لَهُمْ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَيْنَهُمَاۗ فَلْيَرْتَقُوا فِي الْاَسْبَابِ﴿١٠﴾ جُنْدٌ
مَا هُنَالِكَ مَهْزُومٌ مِنَ الْاَحْزَابِ ﴿١١﴾ كَذَّبَتْ قَبْلَهُمْ قَوْمُ نُوحٍ وَعَادٌ وَفِرْعَوْنُ ذُو الْاَوْتَادِۙ ﴿١٢﴾
وَثَمُودُ وَقَوْمُ لُوطٍ وَاَصْحَابُ لْـَٔيْكَةِۜ اُو۬لٰٓئِكَ الْاَحْزَابُ ﴿١٣﴾

---

**sinəsində şöləlkənib, dedilər: "Bəs bizim aramızdan Allah-Təala bu** (Məhəmmədi) **seçib, ona Quran göndərdi? Belə şey ola bilməz".** (بَلْ هُمْ فِي شَكٍّ مِنْ ذِكْر۪يۚ) - (Ey Məhəmməd), **bəlkə bu müşriklər mənim sənə göndərdiyim Quranımın haqqında şəkdədirlər?** (بَلْ لَمَّا يَذُوقُوا عَذَابِ) **İnsan zülmə tabedir. Bəlkə bu müşriklər hələ mənim əzabımı dadmayıblar, ona görə Quranı qəbul etməyib, ona şəkk edirlər? Elə ki, onlara əzab gəldi, o vaxt Quranın haqq olduğunu bilərlər. Lakin onlara fayda verməz.**

**9)** (اَمْ عِنْدَهُمْ خَزَٓائِنُ رَحْمَةِ رَبِّكَ الْعَز۪يزِ الْوَهَّابِۚ) **- Yoxsa,** (Ey Məhəmməd), **cəmi məxluqata qalib olan, peyğəmbərliyi öz hikməti üzrə layiq olana bağışlayan rəbbin Allah-Təalanın rəhmət xəzinələrinə bu Qüreyş camaatı malikdir ki, istədikləri şəxsə peyğəmbərliyi versinlər.** (Necə ki, dedilər: "Peyğəmbərlik Məkkədə Vəlid ibn Müğirədə, ya da ki, Taifdə Urvə ibn Məsud Səqəfidə gərək olsun. Çünkü bunlar böyük, varlı şəxsdirlər).

**10)** (اَمْ لَهُمْ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَيْنَهُمَاۗ) **- Ya da ki, bu Qüreyş camaatından ötrü bəlkə göylərin və yerin, onların arasında olan hər bir şeyin səltənəti və ixtiyarı vardır? Belə sözlər danışırlar, əgər onlarda belə ixtiyar var isə,** (فَلْيَرْتَقُوا فِي الْاَسْبَابِ) **özlərindən ötrü səbəblər tapıb, o səbəblərlə yuxarı - tanrılıq mərtəbəsinə çıxıb hər bir şeyin idarəsinə malik olsunlar. O vaxt da kimi istəyirlər peyğəmbər seçsinlər. İndi ki, onlar belə aciz və zəlil məxluqdurlar, Allah-Təalanın işlərinə niyə müdaxilə edirlər?**

**11)** (جُنْدٌ مَا هُنَالِكَ مَهْزُومٌ مِنَ الْاَحْزَابِ) - (Ey Məhəmməd), **o kafir və müşriklər ki, yığılıb, qoşun hazırlayıb, Allah-Təalanın peyğəmbərləri ilə savaşa çıxıblar, bu Qüreyş tayfası da onlardan bir qoşundur. Onlardan heç qorxma. Allah-Təala səni onlara qalib edib, onlar dağılıb, məhv olacaqlar.** (Allah-Təalanın vədi doğru olub, Bədir savaşında Allah-Təala öz peyğəmbərini müşriklərə qalib edib, hamısı zəlil oldu).

**12)** (كَذَّبَتْ قَبْلَهُمْ قَوْمُ نُوحٍ وَعَادٌ وَفِرْعَوْنُ ذُو الْاَوْتَادِۙ) - (Ey Məhəmməd), **təkzib olunan bir tək sən deyilsən, bəlkə, səni təkzib edənlərdən əvvəl Nuh peyğəmbəri və Ad camaatı** (Hudu), **son dərəcə möhkəm səltənəti olan, izzət və şərafət sahibi firon da** (Musanı) **təkzib ediblər.**

**13)** (وَثَمُودُ وَقَوْمُ لُوطٍ وَاَصْحَابُ لْـَٔيْكَةِۜ اُو۬لٰٓئِكَ الْاَحْزَابُ) **- Səmud camaatı** (Salehi), **Lut camaatı** (Lutu), **Əykə camaatı** (Şüeybi) **təkzib etdilər. Bu yad olunan camaatlar Allah-Təalanın peyğəmbərlərinə asi olub, itaət etməyən camaatlardır. Allah-Təala onları dağıdıb, peyğəmbərlərini onlara qalib etdi.**

اِنْ كُلٌّ اِلَّا كَذَّبَ الرُّسُلَ فَحَقَّ عِقَابِ ﴿١٤﴾ وَمَا يَنْظُرُ هٰۤؤُلَاۤءِ اِلَّا صَيْحَةً وَاحِدَةً مَا لَهَا مِنْ فَوَاقٍ
﴿١٥﴾ وَقَالُوا رَبَّنَا عَجِّلْ لَنَا قِطَّنَا قَبْلَ يَوْمِ الْحِسَابِ ﴿١٦﴾ اِصْبِرْ عَلٰى مَا يَقُولُونَ وَاذْكُرْ عَبْدَنَا
دَاوُدَ ذَا الْاَيْدِ اِنَّهُ اَوَّابٌ ﴿١٧﴾ اِنَّا سَخَّرْنَا الْجِبَالَ مَعَهُ يُسَبِّحْنَ بِالْعَشِيِّ وَالْاِشْرَاقِ ﴿١٨﴾ وَالطَّيْرَ
مَحْشُورَةً كُلٌّ لَهُ اَوَّابٌ ﴿١٩﴾ وَشَدَدْنَا مُلْكَهُ وَاٰتَيْنَاهُ الْحِكْمَةَ وَفَصْلَ الْخِطَابِ ﴿٢٠﴾

---

(Ey Məhəmməd), axırda Allah-Təala səni də müşriklərə qalib edəcəkdir).

**14) (اِنْ كُلٌّ اِلَّا كَذَّبَ الرُّسُلَ فَحَقَّ عِقَابِ) - Bu yad olunan camaatlar onlara göndərilən peyğəmbərləri təkzib etdilər. O səbəbdən mənim əzabıma layiq olub dünya və axirət əzabına düçar oldular.**

**15) (وَمَا يَنْظُرُ هٰۤؤُلَاۤءِ اِلَّا صَيْحَةً وَاحِدَةً مَا لَهَا مِنْ فَوَاقٍ) -** (Ey Məhəmməd), **bu Qüreyş camaatı ancaq bircə dəhşətli səsi gözləyir ki, o səs** (Bədir günü) **onlara gəlib, onlardan yan keçməyib, hamısını həlak edəcəkdir.** (Bunlar Allahın Rəsuluna təsəlli vermək üçündür. Allahın Rəsulu möminlərə cənnət vədi verib, onlara ilahi lütflərdən bəhs edəndə Məkkə əhli olan Qüreyş müşrikləri istehza ilə dedilər: “İlahi, bizim hissəmizi dünyada bizə ver, axirətdə bizə lazım deyil. Necə ki növbəti ayədə xəbər verir).

**16) (وَقَالُوا رَبَّنَا عَجِّلْ لَنَا قِطَّنَا قَبْلَ يَوْمِ الْحِسَابِ) - İstehza ilə dedilər: “Ey bizim rəbbimiz, bizim hissəmizi cənnətdən, hesab günündən əvvəl bizə ver, axirətdə bizə lazım deyildir.**

**17) (اِصْبِرْ عَلٰى مَا يَقُولُونَ وَاذْكُرْ عَبْدَنَا دَاوُدَ ذَا الْاَيْدِ اِنَّهُ اَوَّابٌ) -** (Ey Məhəmməd), **bu Qüreyş camaatının əziyyətlərinə səbir edib, Allah-Təalaya cüzi də olsa asi olmağın sonsuz çirkinliyini onlara bildirməkdən ötrü bizim bəndəmiz Davudun əhvalatını - hansı ki, güclü iman sahibi və tövbə edib Allah-Təala tərəfinə qayıdan idi, onlardan ötrü yad et ki, Allah-Təala elə bəndəsini bir cüzi xətadan ötrü necə böyük bəla və müsibətə düçar etdi. Bəs siz bu müsibətlərlə Allah-Təaladan qorxmazsınızmı?**

**18) (اِنَّا سَخَّرْنَا الْجِبَالَ مَعَهُ يُسَبِّحْنَ بِالْعَشِيِّ وَالْاِشْرَاقِ) -** (Ey Məhəmməd), **həqiqətən, biz dağları Davuda tabe etdik. Səhər gün çıxanda, bir də axşam vaxtı Davudla səs-səsə verib, Allah-Təalanı zikr edib, uca sayardılar.**

**19) (وَالطَّيْرَ مَحْشُورَةً كُلٌّ لَهُ اَوَّابٌ) - Quşları da hər bir tərəfdən cəm etdik, Davud gözəl səslə dua edəndə, onlar da Allah-Təalanı zikr edərdilər.**

**Dağlar və quşların hamısı Davudun səsinə səs verərdilər.** (Dağlar Davudun səsinə əks-səda verdiyi kimi, quşlar da onun gözəl səsindən ilhama gəlib, tərənnüm edib nəğmə oxuyardılar).

**20) (وَشَدَدْنَا مُلْكَهُ وَاٰتَيْنَاهُ الْحِكْمَةَ وَفَصْلَ الْخِطَابِ) -** (Ey Məhəmməd), **Davudun səltənətini möhkəm edib, qüvvət verdik. Cəmi asilər ona tabe olub,**

وَهَلْ اَتٰيكَ نَبَؤُا الْخَصْمِۘ اِذْ تَسَوَّرُوا الْمِحْرَابَۙ ﴿٢١﴾ اِذْ دَخَلُوا عَلٰى دَاوُدَ فَفَزِعَ مِنْهُمْ قَالُوا لَا تَخَفْۚ خَصْمَانِ بَغٰى بَعْضُنَا عَلٰى بَعْضٍ فَاحْكُمْ بَيْنَنَا بِالْحَقِّ وَلَا تُشْطِطْ

---

**onun xidmətinə girdilər. Bununla belə hər bir şeyin həqiqətini dərk edib, şəriət hökmlərində və səltənət işlərində haqla batil arasına fərq qoyub, ədalət üzrə hökm etmək məsələsini də Davuda bəxş etdik. (Davudun ordu sərkərdələrindən Urya adlı bir nəfər bir qadına elçi göndərib evlənmişdi. Onun elçiliyinin qəbulundan sonra Davud o qadına elçi göndərdi. O qadını Uryadan ayırıb, Davuda verdilər. Bu mətləbin Davud kimi peyğəmbərdən vaqe olması çirkin iş sayılır,** (islam şəriətində bir şəxs bir qadın üçün elçi göndərəndə, əgər rədd edilməyibsə, başqa bir şəxsin ona elçi göndərməsi caiz deyildir). **Cənab Davud Uryanın elçilik məsələsindən xəbərdar olmayıb o qadını nikahladı. Bu mətləb camaatın böyüklərinə ağır gəldi. Yəni ey Davud, sənin ki neçə arvadın vardır, bu kişinin istədiyi arvadı nədən ötrü aldın? O barədə iki nəfər şəxs Davudun yanına gedib, ondan bu məsələni soruşdular.** (Davud öz elçilik məsələsinin mahiyyətindən agah olub uzun zaman ağlayıb tövbə etdi. Belə ki, Allah-Təala onun tövbəsini qəbul etdi. Necə ki, Allah-Təala sıradakı ayədə kinayə yolu ilə həmin mətləbi xəbər verir. Bəzi təfsirçi alimlər Davud barəsində ədalət və insafdan kənar sözlər deyiblər. Hansı ki, o sözləri alçaq şəxslərə də isnad etmək layiq deyildir. O sözləri bu kitabda qeyd etməyə layiq görməyib, qələmi saxladım. Hər şəxs o sözlərə agah olmaq istəsə, digər təfsir kəlamlarına baxsın. Cənab Əli (ə.s) buyurubdur: "Bir şəxs ki, Davudun qissəsini qissə və hekayə danışanlar kimi (bəzi təfsirçilərin yazdığı kimi) danışsa, o şəxsə 160 qamçı (peyğəmbərlərə iftira etmə cəzası) cəzası verərəm").

**21) (وَهَلْ اَتٰيكَ نَبَؤُا الْخَصْمِۘ اِذْ تَسَوَّرُوا الْمِحْرَابَ) -** (Ey Məhəmməd), **bəs sənə bir-biri ilə dalaşıb, düşmənçilik edən şəxslərin xəbəri gəlib çatıbdır? Hansı ki, divardan aşıb ibadətxanada** (Davudun) **hüzuruna daxil oldular, əlbəttə bu xəbər sənə gəlməyib, qulaq as ki, bu qissəni səndən ötrü bəyan edək.** (Əlbəttə, belə bir söz bir şəxsə deyiləndə, o şəxs o qissəni eşitməyə maraq göstərəcəkdir və bu səbəbdən Allahın Rəsulu Davudun qissəsini eşitmək üçün həvəslənib, gözləməyə başladı. Cənab Davud ibadətxanasında tək ibadətlə məşğul idi. Onun qəbul vaxtı olmaya-olmaya bir neçə nəfər qəflətən onun hüzuruna daxil oldu).

**22) (اِذْ دَخَلُوا عَلٰى دَاوُدَ فَفَزِعَ مِنْهُمْ) - Elə ki o şəxslər qəbul vaxtı olmaya-olmaya qəflətən** (Davudun yanına) **daxil oldular. Davud onlardan qorxdu ki, bəlkə də onu qətl etməkdən ötrü izinsiz onun hüzuruna gəliblər. (قَالُوا لَا تَخَفْۚ خَصْمَانِ بَغٰى بَعْضُنَا عَلٰى بَعْضٍ) - Elə ki onlar Davudun qorxmağını gördülər, dedilər: "Qorxma, biz bir-birimizə düşmənçilik edib, zülm**

وَاهْدِنَآ اِلٰى سَوَآءِ الصِّرَاطِ﴿٢٢﴾ اِنَّ هٰذَآ اَخِي لَهُ تِسْعٌ وَتِسْعُونَ نَعْجَةً وَلِيَ نَعْجَةٌ وَاحِدَةٌ فَقَالَ اَكْفِلْنِيهَا وَعَزَّنِي فِي الْخِطَابِ ﴿٢٣﴾ قَالَ لَقَدْ ظَلَمَكَ بِسُؤَالِ نَعْجَتِكَ اِلٰى نِعَاجِهِ وَاِنَّ كَثِيرًا مِنَ الْخُلَطَآءِ لَيَبْغِي بَعْضُهُمْ عَلٰى بَعْضٍ اِلَّا الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ وَقَلِيلٌ مَا هُمْ

---

**edərkən sənin hüzuruna məhkəmə üçün gəlmişik. (فَاحْكُمْ بَيْنَنَا بِالْحَقِّ وَلَا تُشْطِطْ) Haqq və ədalətlə bizim aramızda hökm edib, hökmdə haqdan kənar olub, zülm və əziyyət etmə. (وَاهْدِنَآ اِلٰى سَوَآءِ الصِّرَاطِ) - Bizə haqq yolu göstərib, əsl haqq olan hökmü bizdən ötrü bəyan et.** (Davud buyurdu: “Sualınız nədirsə, bəyan edin”).

**23) (اِنَّ هٰذَآ اَخِي لَهُ تِسْعٌ وَتِسْعُونَ نَعْجَةً وَلِيَ نَعْجَةٌ وَاحِدَةٌ) - Onlardan biri dedi: “Bu, mənim qardaşımdır. Bunun 99 qoyunu vardır. Mənim bircə qoyunum var. (فَقَالَ اَكْفِلْنِيهَا وَعَزَّنِي فِي الْخِطَابِ) - O qardaşım mənə dedi ki, o bir qoyunu da mənə ver, ona sahib olum ki, mənim qoyunlarımın sayı 100-ə çatsın. Mənə mübahisədə qalib gəlib, o bit qoyunu məndən aldı. Bu barədə bizim aramızda hökm et.** (Təfsirçilər deyiblər: “O şəxslər insan surətində olan mələklər idi əlbəttə, insaflı və adil şəxslər insan surətində olan mələklərdir).

**24) (قَالَ لَقَدْ ظَلَمَكَ بِسُؤَالِ نَعْجَتِكَ اِلٰى نِعَاجِهِ) - Davud o şəxsə cavab verib dedi: “Əgər məsələ sən deyən kimi isə, həqiqətən, qardaşın sənin bir qoyununu öz qoyunlarına qoşmaq üçün səndən istəməklə sənə zülm edibdir. (وَاِنَّ كَثِيرًا مِنَ الْخُلَطَآءِ لَيَبْغِي بَعْضُهُمْ عَلٰى بَعْضٍ اِلَّا الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ وَقَلِيلٌ مَا هُمْ) - Həqiqətən, ortaqların əksəriyyəti bir-birinə zülm edir, ancaq o şəxslər ki, Allah-Təalaya iman edib və saleh əməl edir, onlar da azdırlar və az olmaları da təəccüblü bir işdir. Çünki iman edən gərək çox olaydı, lakin əksinə olubdur.** (Ondan sonra (Davud) onun qardaşına dedi: “Nədən ötrü onun qoyununu zorla alırsan? Dedi: “İstəyirəm, mənim qoyunlarımın sayı 100-ə çatsın. (Davud) ona cavab verib dedi: “Əgər sən bu əməli edibsənsə, sənin burnuna və alnına vurub sındıraram. O şəxs yoldaşına baxıb, təbəssüm etdi, dedi: “Ey (Davud)* buruna və alına vurulmağa sən layiqsən. Gərək sənin burnuna və alnına vurulsun”. O vaxt Davud agah oldu ki, onların məqsədi məhkəmə deyil, bəlkə də onun əməlinə - Uryanın istədiyi qadını almasına işarədir. Necə ki, ayədə Allah-Təala buyurur).

*(*Qeyd: “Haqq sözü deyən şəxs belə olar. (Davud) kimi sultanın üzünə cürət edib elə söz demək kişiliyin ən yüksək dərəcəsidir. Haqq danışıb haqq söyləyən şəxslər, gərək, bu sifətdə olsunlar. Allah-Təalanın Davudun əhvalatını Qurani- şərifdə yad etməsindən məqsəd bizə ancaq qissə və hekayə danışmaq deyildir, bəlkə ibrət alıb, gözəl əxlaq əldə etməkdir. Yəni elə insanlar olub ki, Davud kimi peyğəmbəri də öz xətasından xəbərdar edib tövbə etdiriblər. Qurani-Şərifə tabe olan sizlər onlara tabe olub, zülmdən kənar olub, ədaləti*

وَظَنَّ دَاوُۨدُ اَنَّمَا فَتَنَّاهُ فَاسْتَغْفَرَ رَبَّهُ وَخَرَّ رَاكِعًا وَاَنَابَ ﴿٢٤﴾ فَغَفَرْنَا لَهُ ذٰلِكَ ؕ وَاِنَّ لَهُ عِنْدَنَا لَزُلْفٰى وَحُسْنَ مَاٰبٍ ﴿٢٥﴾ يَا دَاوُۨدُ اِنَّا جَعَلْنَاكَ خَلِيفَةً فِي الْاَرْضِ فَاحْكُمْ بَيْنَ النَّاسِ بِالْحَقِّ وَلَا تَتَّبِعِ الْهَوٰى فَيُضِلَّكَ عَنْ سَبِيلِ اللّٰهِ ۜ اِنَّ الَّذِينَ يَضِلُّونَ عَنْ سَبِيلِ اللّٰهِ لَهُمْ عَذَابٌ شَدِيدٌ بِمَا نَسُوا يَوْمَ الْحِسَابِ ۟﴿٢٦﴾

---

*özünüzə şüar seçin. Davudun hüzuruna məhkəmə üçün gedən şəxslərdən belə böyük faydalar əmələ gəlib. Lakin təfsirçilər onlara məlaikə deyiblər. Bəli, bir ayənin mənası onlara müşkül olanda ayəni məlaikə, cin, axirət, qiyamət, ya da ki xəyali mənalara yozurlar. Faydalı işi tərk edib, məntiqsiz və faydasız bir işlə məşğul olmaq son dərəcə təəccüblüdür. Nəyə görə təfsirçilər həmin ayədən ibrət almırlar, guya onların nəzərində məlaikə elə bir məxluqdur ki, hər bir vaxt, hər bir şəxslə əyləşib, söhbət edə bilərmiş. Necə ki, Tövrata baxanda guya Allah-Təala Bəni-İsrail arasında onlardan bir nəfər kimi bir şəxs olub və hər bir işlərində onunla məşvərət və məsləhət ediblər. Heyif ki, nə Allah-Təala və nə də məlaikə bizlərə etina etməyib, bizimlə danışmırlar, görünür bizi bəndəlikdən kənar ediblər. Məlaikənin Davudun yanına gəlməsindən nə fayda hasil olar? Bunlar o şəxslər deyil ki, Allah-Təalanın arzu və məqsədini dərk etməyib, hər bir iş onlara müşkül olanda, məlaikə deyib, o işi müxtəsər şəkildə anladıb gediblər. Əgər şəriət dilində istifadə edilən məlaikənin həqiqətini dərk etsə idilər, hər halda Allah-Təalanın möcüzəli bəyanına belə məntiqsiz mənalar yükləməzdilər. Haqq və doğru yola götürən Allah-Təaladır).*

**(وَظَنَّ دَاوُۨدُ اَنَّمَا فَتَنَّاهُ) -** (Ey Məhəmməd), (Davud) **onların sözündən bildi ki, biz onu bəlaya düçar etmişik.** (Uryanın) **istədiyi arvadı almaq nalayiq bir əməldir ki, o, edib. (فَاسْتَغْفَرَ رَبَّهُ وَخَرَّ رَاكِعًا وَاَنَابَ) -** (Davud) **rəbbi olan Allah-Təaladan əfv istəyib, tövbədən ötrü namazla məşğul oldu. Namazda səcdə edib, öz əməlindən Allah-Təalaya döndü.**

**25) (فَغَفَرْنَا لَهُ ذٰلِكَ) - Həmin xətanı tövbə etməsi səbəbi ilə Davuda bağışladıq. (وَاِنَّ لَهُ عِنْدَنَا لَزُلْفٰى وَحُسْنَ مَاٰبٍ) - Həmin əfvdən sonra** (Davud) **üçün bizim yanımızda yaxınlıq və axirətdə qayıdıb gələcəyi gözəl yer vardır.**

**26) (يَا دَاوُۨدُ اِنَّا جَعَلْنَاكَ خَلِيفَةً فِي الْاَرْضِ فَاحْكُمْ بَيْنَ النَّاسِ بِالْحَقِّ) -** (Ey Məhəmməd), **ondan sonra** (Davuda) **xitab edib dedik): "Ey Davud, günahını iqrar edib tövbə etdiyin üçün səni yer üzündə özümüzə canişin təyin etdik, xalq arasında haqq və ədalətlə hökm et.**

**(وَلَا تَتَّبِعِ الْهَوٰى فَيُضِلَّكَ عَنْ سَبِيلِ اللّٰهِ) -** (Ey Davud), **hər bir işdə bizi düşünüb, bizim hökmümüzə tabe olub öz nəfsinə tabe olma, nəfsinə tabe olmaq səni Allah-Təalanın yolundan kənara salar.**

**(اِنَّ الَّذِينَ يَضِلُّونَ عَنْ سَبِيلِ اللّٰهِ لَهُمْ عَذَابٌ شَدِيدٌ بِمَا نَسُوا يَوْمَ الْحِسَابِ ۟) -** (Ey Davud),

وَمَا خَلَقْنَا السَّمَآءَ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَا بَاطِلًاۜ ذٰلِكَ ظَنُّ الَّذ۪ينَ كَفَرُواۚ فَوَيْلٌ لِلَّذ۪ينَ كَفَرُوا مِنَ النَّارِۜ
﴿٢٧﴾ اَمْ نَجْعَلُ الَّذ۪ينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ كَالْمُفْسِد۪ينَ فِي الْاَرْضِۘ اَمْ نَجْعَلُ الْمُتَّق۪ينَ
كَالْفُجَّارِ ﴿٢٨﴾ كِتَابٌ اَنْزَلْنَاهُ اِلَيْكَ مُبَارَكٌ لِيَدَّبَّرُٓوا اٰيَاتِه۪ وَلِيَتَذَكَّرَ اُو۬لُوا الْاَلْبَابِ ﴿٢٩﴾ وَوَهَبْنَا
لِدَاوُ۫دَ سُلَيْمٰنَۜ نِعْمَ الْعَبْدُۜ اِنَّهُ اَوَّابٌۜ ﴿٣٠﴾ اِذْ عُرِضَ عَلَيْهِ بِالْعَشِيِّ الصَّافِنَاتُ الْجِيَادُۙ ﴿٣١﴾

---

**həqiqətən, o şəxslər ki, şəriətin hökmündən və ağlın dəlillərindən kənara düşüb, şəri əmr edən nəfsə tabe olublar və o səbəbə görə ki, hesab** (qiyamət) **gününü unudublar, onlardan ötrü şiddətli əzab vardır.**

**27) (وَمَا خَلَقْنَا السَّمَآءَ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَا بَاطِلًاۜ) -** (Ey Məhəmməd), **göyü və yeri və onların arasında hər bir məxluqu batil və əbəs yerə yaratmamışıq, bəlkə hamısını doğru bir məqsəd və hikmət üzrə yaratmışıq. Xüsusən insan nəslini yaradıb, onları digər məxluqatdan ağıl səbəbi ilə üstün etmişik. Belə ki, bizim əzəmət və qüdrətimiz haqqında təfəkkür edib imanı küfrə, tövhidi şirkə üstün saysınlar. (ذٰلِكَ ظَنُّ الَّذ۪ينَ كَفَرُواۚ) - Kafirlərin zənni və gümanı odur ki, bu məxluqlar batil və əbəs yerə yaradılıblar. (فَوَيْلٌ لِلَّذ۪ينَ كَفَرُوا مِنَ النَّارِ) - O kafirlərə cəhənnəm odundan əzab olsun.**

**28) (اَمْ نَجْعَلُ الَّذ۪ينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ كَالْمُفْسِد۪ينَ فِي الْاَرْضِۘ) -** (Ey Məhəmməd), **kafirlər deyən kimi əgər bu məxluqat batil və əbəs olsaydı, gərək biz iman gətirib xeyir əməl sahiblərini də yer üzündə fəsad edənlərlə eyni sayardıq. Bəs bu əməl sizə layiqdirmi? Bu əməl səfehlərdən meydana gələr, nəinki hikmət sahibindən. (اَمْ نَجْعَلُ الْمُتَّق۪ينَ كَالْفُجَّارِ) - Ya da ki, müttəqi** (mömin) **şəxsləri günahkar fasiqlər kimi qəbul edək, daha onlardan ötrü nə cənnət və nə də bir mükafat olmaz. Belə iş mümkün deyildir. Bunlar hamısı qiyaməti inkar edən şəxslərin gümanıdır. Bəlkə saleh və müttəqilərə mükafat, fəsadçılara və günahkarlara cəza verilər.**

**29) (كِتَابٌ اَنْزَلْنَاهُ اِلَيْكَ مُبَارَكٌ ) -** (Ey Məhəmməd), **bu Quran xeyirli və mənfəətli kitabdır. Onu sənə nazil etdik ki, xalqa oxuyasan. (لِيَدَّبَّرُٓوا اٰيَاتِه۪) - Belə ki, xalq onun açıq-aydın ayələrinin ehtiva etdiyi incə mənanı və heyrətli sirləri təfəkkür edib, din və dünya işlərinin sahibini anlasınlar. (وَلِيَتَذَكَّرَ اُو۬لُوا الْاَلْبَابِ) - Və əlbəttə ağıl və bəsirət sahibləri bunu xatırlayıb, Qurani-Şərifin əsrarını dərk edəcəklər.**

**30) (وَوَهَبْنَا لِدَاوُ۫دَ سُلَيْمٰنَۜ نِعْمَ الْعَبْدُۜ اِنَّهُ اَوَّابٌ) -** (Ey Məhəmməd), **Süleymanı** (Davuda) **bəxş etdik. Süleyman bizim nə gözəl bəndəmiz idi. Həqiqətən, hər bir işində bizim tərəfimizə dönən idi.**

**31) (اِذْ عُرِضَ عَلَيْهِ بِالْعَشِيِّ الصَّافِنَاتُ الْجِيَادُ) -** (Allah-Təala bu ayədə cənab Sü-

فَقَالَ اِنّٖٓي اَحْبَبْتُ حُبَّ الْخَيْرِ عَنْ ذِكْرِ رَبّٖيۚ حَتّٰى تَوَارَتْ بِالْحِجَابِۙ ﴿٣٢﴾ رُدُّوهَا عَلَيَّۜ فَطَفِقَ مَسْحًا بِالسُّوقِ وَالْاَعْنَاقِ ﴿٣٣﴾

---

leymanın cihad işinə göstərdiyi əhəmiyyəti bəyan edir ki, biz də ibrət alıb, həmişə cihad məsələsində diqqətli və hazır olub, mal və canımızı fəda etməkdən çəkinməyək). **O zaman ki cənab Süleyman günortadan sonra səhraya çıxdı, bir ayağını dırnağı üstə qoyub, üç ayağı üstə duran cins atları onun hüzuruna gətirdilər.** (Cənab Süleyman cihad üçün həmişə cins atlar saxlayıb, onlara təlim verməyi əmr edirdi. Özü səhraya çıxıb, onları çapdırıb sürətlərinə, hərəkətlərinə, duruşlarına diqqət edərdi. Hər bir atın şanına müvafiq olaraq, onu mühafizə etməyi əmr edərdi).

**32) (فَقَالَ اِنّٖٓي اَحْبَبْتُ حُبَّ الْخَيْرِ عَنْ ذِكْرِ رَبّٖيۚ) - Cənab Süleyman səhraya çıxandan sonra atları çapdırmağı hökm etdi. Elə ki, atları çapdılar, dedi: "Mən bu atları dünya və nəfsdən ötrü istəmirəm, bəlkə Allah-Təalanın dininə qüvvət verməkdən ötrü onları istəyirəm. Həqiqətən, atları rəbbim Allah-Təalanın xeyirli və gözəl zikrini istədiyim kimi çox istəyirəm", (حَتّٰى تَوَارَتْ بِالْحِجَابِۙ ) - ta ki, atlar uzaqlaşıb,** (yerin kürə şəklində olmasına görə, ya da ki, havanın sisli olması səbəbi ilə) **onlarla Süleyman arası pərdələnib, Süleymanın gözündən qeyb oldular.**

**33) (رُدُّوهَا عَلَيَّ) - Elə ki, atlar qayıdıb Süleymana yaxınlaşdılar, dedi: "Onları mənim tərəfimə qaytarın. (فَطَفِقَ مَسْحًا بِالسُّوقِ وَالْاَعْنَاقِ)* - Elə ki atları onun hüzuruna qaytardılar, onlara olan məhəbbətin çoxluğundan onların ayaqlarına və boyunlarına sığal çəkib nəvaziş etməyə başladı.**

(Cənab Süleymanın çoxlu xanımı və kənizləri var idi. Bir gün dedi: "Bu gecə bütün xanımlarımın yanına gedib onlarla yaxınlıq edəcəm ki, hər birindən oğlum olsun. Cənab Süleyman bir növ səltənəti ilə təkəbbürləndiyindən bu sözü deyib, onu Allah-Təalanın iradəsinə həvalə etmədi. O xanımların heç birindən övladı olmayıb, ancaq birindən bir parça ət kimi şey doğuldu. Süleyman bundan agah olub, dediyi sözdən peşman olub, tövbə etdi. Necə ki, Allah-Təala növbəti ayədə xəbər verir).

*(*__Qeyd:__ Bu məna ki, bu ayələrdən ötrü bəhs edildi, insaf əhli əgər diqqətlə baxsa, din və dünya işlərinə aid olan nə gözəl mənadır. Lakin təfsirçilərin əksəriyyəti bunun xilafına başqa mənalar qeyd ediblər. Bizim bu məna bəzi cəhətlərdən təfsirçi İmam Fəxrəddin-Razinin qeyd etdiyi mənaya müvafiqdir. Lakin digər təfsirçilər belə zikir ediblər: "Süleyman çıxıb atları tamaşa etməklə məşğul oldu. Zöhr namazını qılmışdı. Onları tamaşa etməkdən əsr namazını unutdu, günəşin batması səbəbi ilə namazı da qıla bilmədi. Dedi: "Atları gətirin mənim yanıma. Gətirdilər. Bir qılınc götürüb başladı atların*

وَلَقَدْ فَتَنَّا سُلَيْمٰنَ وَاَلْقَيْنَا عَلٰى كُرْسِيِّهٖ جَسَدًا ثُمَّ اَنَابَ ﴿٣٤﴾ قَالَ رَبِّ اغْفِرْ لِي وَهَبْ لِي مُلْكًا لَا يَنْبَغِي لِاَحَدٍ مِنْ بَعْدِيۚ اِنَّكَ اَنْتَ الْوَهَّابُ ﴿٣٥﴾ فَسَخَّرْنَا لَهُ الرِّيحَ تَجْرِي بِاَمْرِهٖ رُخَاۤءً حَيْثُ اَصَابَۙ ﴿٣٦﴾

---

*ayaq və boyunlarını kəsməyə ki, o namazının "kəffarə"si (günahı əfv üçün əməl) olsun. Yüzlərlə atı qətl etdi və təfsirçilər deyiblər: "Hərçənd belə əməl bizdən ötrü caiz deyildir, amma ondan ötrü caiz imiş.*

*Ta ki, əsr namazını qıldı. (فَاعْتَبِرُوا يَا أُولِي الْأَلْبابِ - Ey ağıl sahibləri ibrət alın!) Bəs belə bir gözəl mənanı qoyub Quran ayələrinə belə bir səhv məna yükləmək rəvadırmı? Görəsən, hansı din və məzhəbdə at kimi nəcib heyvanı səbəbsiz yerə qətl etmək caiz olubdur? İnsaf və məntiqlə caiz olmayan şey şəriətdə də caiz olmaz. Şəriət ehkamı gərək ağla müvafiq olsun. "Ağlın hökm etdiyi şeyə şəriət də hökm edər" sözü alimlərin dilində bir qanundur və bu səbəbdən Allahın peyğəmbəri Süleyman ibn Davuda belə xilaf əməli isnad etmək münasib deyildir).*

**34)** (وَلَقَدْ فَتَنَّا سُلَيْمٰنَ وَاَلْقَيْنَا عَلٰى كُرْسِيِّهٖ جَسَدًا ثُمَّ اَنَابَ) - (Ey Məhəmməd), **həqiqətən Süleymanı imtahan edib, onu bəlaya salıb, o qədər arvadlarından övladı olmayıb, ancaq bir arvadından bir parça ət kimi bir cəsədi onun taxtının üstünə qoyduq, ondan sonra Süleyman məsələdən agah olub, dediyi sözdən tövbə edib, bizim tərəfimizə qayıtdı.**

**35)** (قَالَ رَبِّ اغْفِرْ لِي وَهَبْ لِي مُلْكًا لَا يَنْبَغِي لِاَحَدٍ مِنْ بَعْدِيۚ اِنَّكَ اَنْتَ الْوَهَّابُ) - **Dedi: "Ey mənim rəbbim, məni bağışlayıb mənə bir səltənət və padşahlıq ver ki, məndən sonra heç bir şəxsdən ötrü belə səltənət mümkün olmayıb, heç bir şəxsə verməyəsən. Həqiqətən, sən çox bəxşiş verənsən."**

**36)** (فَسَخَّرْنَا لَهُ الرِّيحَ تَجْرِي بِاَمْرِهٖ رُخَاۤءً حَيْثُ اَصَابَ ) - (Ey Məhəmməd),* **Süleymanın duasını qəbul edib, küləyi ona tabe etdik. Onun əmrilə son dərəcə rahat və aram şəkildə hər bir tərəfə istəsəydi, gedib onun xalısını aparardı.**

*(***Qeyd:** *Hədisdə varid olubdur ki, Süleymanın bir xalısı var idi, o xalıya özü və köməkçiləri əyləşib, hər bir tərəfə istəsəydi, külək onun xalısını aparıb, məqsədinə çatardı. Həqiqətən, Allah-Təalanın ayədə xəbər verdiyinə görə belə bir şey Süleymanda var imiş. Lakin ola bilər ki, o şeyi cənab Süleyman Allah-Təalanın ona bəxş etdiyi elm qüvvəsilə elə tərtib etmişdi ki, onun iradəsilə külək hər bir vaxt aramla hərəkət edəndə o şeyi məqsədinə tərəf hərəkət etdirirdi. Necə ki, bu zamanda Qərb alimləri həmin bu şeyin - hava gəmisinin icadına müvəffəq olublar. Lakin hələ təkmilləşdirə bilməyiblər. Əlbəttə, şübhəsiz ki, nə zamansa təkmilləşdirəcəklər. Ayədən məqsəd elmin uca dərəcəsini bildirməkdir. Amma təfsir alimləri onu Süleymanın möcüzəsi sayıblar. )*

وَالشَّيَاطِينَ كُلَّ بَنَّآءٍ وَغَوَّاصٍۙ ﴿٣٧﴾ وَاٰخَرِينَ مُقَرَّنِينَ فِي الْاَصْفَادِ ﴿٣٨﴾ هٰذَا عَطَاؤُنَا فَامْنُنْ اَوْ اَمْسِكْ بِغَيْرِ حِسَابٍ ﴿٣٩﴾ وَاِنَّ لَهُ عِنْدَنَا لَزُلْفٰى وَحُسْنَ مَاٰبٍ ﴿٤٠﴾ وَاذْكُرْ عَبْدَنَآ اَيُّوبَۢ اِذْ نَادٰى رَبَّهُ اَنِّي مَسَّنِيَ الشَّيْطَانُ بِنُصْبٍ وَعَذَابٍۜ ﴿٤١﴾

---

**37)** (وَالشَّيَاطِينَ كُلَّ بَنَّآءٍ وَغَوَّاصٍۙ) - (Ey Məhəmməd), **Süleymanın zamanında hər bir yaxşı və gözəl* bənnaları və dənizlərə dalıb** (mirvari və mərcan) **çıxaran mahir dalğıcları - hansı ki, şəxsi xeyir və mənfəətlərini düşünüb, heç bir şəxsə itaət etməzdilər, Süleymana tabe edib onun itaətinə saldıq.**

*(*****Qeyd:*** *"O dövrdə bənnalıq elminin inkişaf etdiyini Allah-Təala Qurani-Şərifdə xəbər verir. Misir, Əndəlüs (ərəb İspaniyası), Fələstin, Rum (Bizans) məmləkətlərində indi də mövcud olan binalar keçmiş dövrlərdə bənnalıq elminin mükəmməlliyinə işarə edir. O məkanlarda mühafizə olunan tikililərdəki bənnalığın xüsusiyyəti tarixçilərə gizli deyildir. Onun həqiqətinə agah olmaq istəyənlər məşhur fəzilətli şəxs olan Misirli Corci Zeydanın "Suniyətül-amm" kitabına baxsınlar).*

**38)** (وَاٰخَرِينَ مُقَرَّنِينَ فِي الْاَصْفَادِ) - (Ey Məhəmməd)**, itaət etməyənləri də bir-birlərilə yaxından zəncirə bağlayıb, zəncirləmiş halda Süleymana tabe etdik.**

**39)** (هٰذَا عَطَاؤُنَا) - (Ey Məhəmməd)**, Süleymana xitab edib dedik: "Sənə verdiyimiz qüvvət və qüdrət bizim böyük bəxşişimizdir.**

(فَامْنُنْ اَوْ اَمْسِكْ بِغَيْرِ حِسَابٍ) **- Sənə ixtiyar verdik, sənin qüdrətinə tabe olan və həbsində olan şəxsləri ya yaxşılıq edib, azad et, ya da ki o halda saxla, o barədə səndən heç bir hesab çəkilməyib və bir zərər sənə yetişməyəcəkdir."**

**40)** (وَاِنَّ لَهُ عِنْدَنَا لَزُلْفٰى وَحُسْنَ مَاٰبٍ) - (Ey Məhəmməd). **dünyada Süleymana belə nemətlər, elm və fəzilət verdik, həqiqətən, ondan ötrü axirətdə, bizim yanımızda, bizə yaxın olan gözəl mənzillər ondan ötrü hazırdır.**

**41)** (وَاذْكُرْ عَبْدَنَآ اَيُّوبَۢ اِذْ نَادٰى رَبَّهُ اَنِّي مَسَّنِيَ الشَّيْطَانُ بِنُصْبٍ وَعَذَابٍۜ) - (Ey Məhəmməd), **bizim bəndəmiz Eyyubu yad edib yadına sal. O zaman ki, xəstəlikdən təngə gəlib öz rəbbi Allah-Təalaya dua edib dedi: "Ey mənim rəbbim, həqiqətən, şeytan mənə bəla və əzab yetirib, naxoş olmuşam, mənim naxoşluğuma şəfa ver.** (Eyyubun bədəni tamamən yara olub xalq ondan üz döndərməyə başladı. Övladları ölüb, malı tələf oldu. Lakin səbir etdi. Axırda səbri tükənən zamanda Allah-Təalaya şikayət edib, xəstəliyinin dəf edilməsini Allah-Təaladan istədi. Hər bir yaman və xəbis əməli şeytana isnad etmək adətindən Eyyub öz xəstəliyini şeytana isnad etdi. Eyyub Allah-Təaladan şəfa istədi. Bəs Allah-Təala ona səbəbsiz şəfa verdimi? Bəlkə onu* müalicə etmək

üçün ona bildirdi ki, sənin müalicən sudur. Gərək, suyla müalicə edəsən. Necə ki sıradakı ayədə xəbər verir).

*(*__Qeyd:__ "Heyf ki, müsəlmanlar Qurani-Şərifin açıq-aydın ayələrindən heç bir fayda götürməyib, hələ də cəhalətdən xilas olmayıblar. Ağır xəstəliklər üçün Allah-Təalanın əmr etdiyi müalicəni tərk edib, dua oxuyub, tilsim yazanlara müraciət edirlər. Bu mətləbdə də əsas müqəssir rəisləridir. Adlarını rəis qoyanlar neçə illər zəhmət çəkib, vətəni tərk edib, öz istəklərinə görə elm təhsilinə gedib, neçə illərdən sonra elə ki, təhsillərini bitirib, vətənə qayıdıb gələndə xalq izdiham içində özünü imamın elçisi sayan bu alimlərə dəstə-dəstə gedib, ondan elm istifadə etməyi arzu edirlər, o vaxt bu alicənabların xalqa ilk təlimi belə olar: "Məsələn, hər bir şəxs İran bayramı olan Novruzun başlayan vaxtında filan duanı zəfəranla yazıb su içində yuyub o sudan içsə, o ildən növbəti ilə qədər o şəxs cəmi afət və xəstəliklərdən salamat olar və ya əgər filan duanı zikr edib, hakim hüzuruna gedəndə oxuyub hakim tərəfinə üfürsə, nə ehtiyacı olsa, həll olar və bundan başqa hər bir xəstəlikdən ötrü onlara bir dua öyrədər. O biçarələr də imamın elçisinin sözünü qəbul etməyib, nə etsinlər? Yəni vəhy olan Qurani-Şərifi tərk edib, ağılsız halda onun axmaq sözlərini qəbul edib, özlərinə fərz hesab edirlər. Mən həqir gənclik vaxtımda Tehran şəhərində olduğum vaxt mübarək Ramazan günlərində vəz verilən məscidlərə getməyə niyyət etdim. Həm hədisi-şərifin məzmununa görə Allah-Təalanın evinə gedən Allah-Təalaya qonaq hesab olunur və ev sahibinə də qonağa hörmət etmək lazımdır və həm də bu xəyalla ki, bu şəhər dini mərkəz olduğuna görə, burada gözəl elm sahibləri və yaxşı vaizlər olub xeyri əmr, şəri qadağan edən, mədəniyyətə dair danışılan sözlərdən, din və dünyaya fayda verən vəzlərdən istifadə edib faydalanım. Hər bir şəhərdə məscidlər məşhur olduğu üçün məscidə getməyə qərar verib getdim, məscidin gözəl həyətinin ortasında böyük bir yerdə xalq dəstəmaz almaqla məşğul idilər. Onlardan keçib məscidin daxilinə varid olanda xalqın camaat namazını qılmaqla məşğul olduğunu gördüm, mən həqir də "Allahın əli camaatın üstündədir" hədisi-şərifini nəzərə alıb, namaza başladım. Namazdan çıxandan sonra ətrafa nəzər saldım. Bəzi dövlət adamlarını və əyanları gördüm. Qabaqlarında böyük qədəhlər, içində də buz var idi. Təəccüb etdim. Görəsən, mübarək Ramazan ayında məsciddə buz nədən ötrüdür? Diqqətlə baxanda məlum oldu ki, onların içinə gülab qoyublar, hərarəti dəf etmək üçün gülabdan istifadəl edib, arxasınca salavat (dua) da deyirlər. Gah da ətraflarında olan şəxslərlə tanış olurlar. Yanımda olan bir şəxs – ağa, bismillah et, peyğəmbərə salavat ver, dedi. Mən də gülab alıb bir salavat dedim. Ondan sonra məscidə nəzər salanda ortada bir pərdə gördüm. Məlum oldu ki, pərdənin o tərəfində qadınlar camaat namazı qılırlar. Elə ki, zöhr namazını qılıb qurtardılar, pərdənin o tərəfindən bir səs-küy ucaldı ki, heyrət içində qaldım. Görəsən nə oldu? Məscid camaatına fikir verdim. Onlarda bir iztirab görməyib, hər şəxsin öz zikri ilə məşğul olduğunu gördüm, məlum oldu ki, qadınlar öz aralarında söhbətlə, ya da ki,*

ٱرْكُضْ بِرِجْلِكَ ۖ هَٰذَا مُغْتَسَلٌۢ بَارِدٌ وَشَرَابٌ ﴿٤٢﴾

*dalaşmaqla məşğuldurlar, 1-2 dəqiqə aradan sonra müəzzin əzan oxuyub xalqı vaxtından əvvəl əsr namazına dəvət etdi. İmam təkbir (Allahü-əkbər) deyib, oxumaqla məşğul oldu. Amma qadınların səs-küyü kəsilmədi. Ta ki imam rükuya getdi, yenə onların səs-küyü kəsilmədi, nə isə 2-ci rüküya gedəndə onlar sakit oldular. Elə ki əsr namazı bitdi, o pərdəni aradan götürdülər. Kişilər qabaqda, qadınlar onların arxasında məscidin ortasında, minbərə tərəf yığıldılar. İmam həzrətləri həmin yerdə səccadə üstündə əyləşib, bir tərəfdən uzun boylu ağ əmmaməli, üzündə çiçək xəstəliyi olan (qanı aşağı  kimi) bir vaiz gəlib minbərə çıxıb, işvə və qəmzə ilə bir neçə kəlmə ərəbcə  xütbə oxuyub, ondan sonra yenə naz-qəmzə ilə Hafiz və Sədinin aşiqanə şeirlərindən bir neçə beyt oxudu (və bu əsnada qadınlara çox iltifat edirdi). Təxminən 10 dəqiqədən sonra minbərdən düşüb getdi. Soruşdum ki, bu vaiz niyə belə təcili getdi? Dedilər:  ağa, (Onların istilahını bəyan edirəm) (farsca ifadə). Dedim: (farsca ifadə) O şəxs dedi: (farsca ifadə) Mən vaizin vəzindən çox onların onu gözləməsinə təəccüb etdim. Hansı ki, o vəzdən nə din, nə də dünya işlərilə əlaqəli bir fayda hasil olan deyildi. Bir gün belə keçdi, o biri gün (Sənkləc) məclisində bir böyük alicənab şeyxin məscidinə varid oldum. Məsciddə olan əhvalat orda da təkrar oldu. Ondan sonra başında qara əmmamə olan qısa boylu bir vaiz gəlib minbərə çıxdı. Salavatdan sonra başladı: (farsca ifadə) Bu şəxs də 10-15 dəqiqə danışıb, təcili o biri məscidə getdi. Bir nəfərdən soruşdum:. (farsca ifadə) Dedi: "Ağa, (farsca ifadə). Bu zaman cənab imam həmin halətdə səccadə üstündə əyləşib bəzi şəxslərlə xeyir-şər mövzularında sual-cavabla məşğul idi. Ondan sonra başqa məscidlərə gedib vəzlərə - hansı ki, nə Allah-Təalanın və nə də uca peyğəmbərin o sözlərdən xəbəri yox idi, qulaq asdım. Görəsən, belə alim və vaizlərdən zəlalət və sapqınlıqdan başqa nə fayda əldə etmək olar? Belə vəzlərdən xalqı fəlakət və cəhalətə salmaqdan başqa bir şey hasil olmaz. Əvvəlcə gərək islam dininin rəis və dəvətçiləri müalicə olunsun. Elə ki, onlardan cəhalət xəstəliyi dəf oldu, digər avam camaatdan da yəqin ki, dəf olacaqdır. Hidayəti verən Allahdır).*

**42) (ٱرْكُضْ بِرِجْلِكَ ۖ هَٰذَا مُغْتَسَلٌۢ بَارِدٌ وَشَرَابٌ) -** (Budur, Allah-Təala bu ayədə Eyyubdan ötrü müalicə bəyan edir*). (Ey Eyyub), **ayaqlarına hərəkət verib, (filan yerdə su var), o suyun yanına get.** (Elə ki, Eyyub gedib o suya yetişdi, Allah-Təala ona xitab edib dedi:) **"Budur, bu, soyuq sudur, həm bu sudan içib, həm də bədənini yuyarsan, o zaman bütün xəstəliklərdən şəfa taparsan".** (Eyyub) **o cür əməl edib şəfa tapdı.**

*(***Qeyd:*** "Ayədə hər bir xəstəliyin müalicəsində, xüsusən soyuq sudan istifadə tövsiyə olunur, necə ki bu zamanda Qərb həkimlərinin rəyi soyuq su ilə müalicə etməyə əsaslanır. (Onun hikməti nə ucadır). Qurani-Şərifin belə*

وَوَهَبْنَا لَهُ اَهْلَهُ وَمِثْلَهُمْ مَعَهُمْ رَحْمَةً مِنَّا وَذِكْرٰى لِاُولِي الْاَلْبَابِ ﴿٤٣﴾ وَخُذْ بِيَدِكَ ضِغْثًا فَاضْرِبْ بِهِ وَلَا تَحْنَثْ

---

*hikmətamiz kəlamlarından Quran əhli necə qafil olubdur, yüz min dəfə heyf, Qurani-Şərifin incəlikləri və rəmzləri gizlin qalıbdır. Belə böyük və ümumi faydası olan ayənin məzmununa Eyyubun möcüzəsi mənasını vermək, nadanlıqdır. Ya həqiqətən Allah-Təala tərəfindən Eyyuba vəhy nazil olub, su ilə müalicə etməyə işarə edildi, ya da ki, onun ağlı bu müalicəni ona göstərdi, insan nəslinə verilən ağıl Allah-Təala tərəfindən əmanət verilən elm olduğuna görə Allah-Təala o müalicəni vəhy kimi fərz edib, Qurani-Şərifdə Allahın Rəsuluna xəbər verir. Lakin təfsirçilər ayənin mənasında belə deyiblər: ("Eyyub ayağını yerə vurdu, yerdən bir çeşmə çıxdı, ondan içib, bədənini yuyub şəfa tapdı, ayədə vaqe olan (urkud) sözünə belə məna veriblər: "Yəni ey Eyyub, ayağını yerə vur. O da Cəbrayılın göstərməsi ilə ayağını yerə vurdu, bir çeşmə ortaya çıxdı, o çeşmədən içib və qüsl edib şəfa tapdı. Ayəyə bizim qeyd etdiyimiz mənanı verə bilməyib, Cəbrayılın göstərməsi ilə ayağını yerə vurmaq mənasını veriblər, halbuki (urdun) sözünün mənası lüğətdə ayağa hərəkət verib qaçmaq mənasınadır. Yəni ey Eyyub, təcilən gedib özünü o suya çatdır, belə doğru mənanı qoyub, Cəbrayılın göstərməsi ilə ayağını yerə vurub, yerdən su çıxartmaq mənasını vermək ayənin məzmunundan kənar bir şeydir).*

**43) (وَوَهَبْنَا لَهُ اَهْلَهُ وَمِثْلَهُمْ مَعَهُمْ) -** (Ey Məhəmməd), **Eyyuba müsibət yetişib həlak olan ailəsinin əvəzinə bir o qədər də ona bəxş etdik.** (Allah-Təala Eyyubun həlak olan övladının əvəzində iki o qədər övladı Eyyuba verdi). **(رَحْمَةً مِنَّا وَذِكْرٰى لِاُولِي الْاَلْبَابِ) - Eyyuba yenidən övlad bağışlamaq bizim tərəfimizdən onun səbrinə görə rəhmət və ağıl sahiblərini agah etmək üçündür ki, Eyyubun səbrinə görə ona vasil olan neməti eşidib, agah olub, hər bir bəla və dərdə səbir etsinlər.** (Cənab Eyyub xəstə halında - necə ki, xəstələrdə müşahidə olunur, öz xanımından inciyib, and içdi ki, əgər Allah-Təala mənə şəfa versə, sənə 100 qamçı, ya da 100 ağac vuracam. Elə ki, şəfa tapdı, o and içməkdən peşman olub, andı pozmağa cürət etmədi. Allah-Təala onun xanımının gözəl xidmətinə görə Eyyuba vəhy göndərdi ki, bir dəstə nazik çubuqdan 100 ədəd götürüb 1 dəfə xanımına vur ki, andı pozmayasan). Andın ehtiramına görə Allah-Təala Eyyuba bu mətləbi bildirdi. Necə ki, növbəti ayədə xəbər verir).

**44) (وَخُذْ بِيَدِكَ ضِغْثًا فَاضْرِبْ بِهِ وَلَا تَحْنَثْ) -** (Ey Məhəmməd), **Eyyuba xitab edib dedik: "Ey Eyyub, xanımın haqqında andı pozmayıb, andın ehtiramını qoruyub, bir dəstə nazik* çubuqdan 100 ədəd götürüb ona vur ki, andını yerinə yetirmiş olasan.** (Eyyub da əməl edib andına vəfa etdi, Eyyubun xanımı hərçənd döyülməyə layiq deyildi, lakin andın ehtiramına görə Allah-Təala Eyyuba belə rəftar etməyi əmr edib və bunu bizə nəql etməkdə

إِنَّا وَجَدْنَاهُ صَابِرًاؕ نِعْمَ الْعَبْدُؕ اِنَّهُ اَوَّابٌ ﴿٤٤﴾ وَاذْكُرْ عِبَادَنَآ اِبْرٰهِيمَ وَاِسْحٰقَ وَيَعْقُوبَ اُو۬لِي الْاَيْدٖي وَالْاَبْصَارِ ﴿٤٥﴾ اِنَّآ اَخْلَصْنَاهُمْ بِخَالِصَةٍ ذِكْرَى الدَّارِۚ ﴿٤٦﴾ وَاِنَّهُمْ عِنْدَنَا لَمِنَ الْمُصْطَفَيْنَ الْاَخْيَارِ ﴿٤٧﴾ وَاذْكُرْ اِسْمٰعٖيلَ وَالْيَسَعَ وَذَا الْكِفْلِؕ وَكُلٌّ مِنَ الْاَخْيَارِؕ ﴿٤٨﴾ هٰذَا ذِكْرٌؕ

---

məqsədi bizə öyrətmək üçündür ki, imkan olduğu qədər and içməyin, əgər and içdinizsə, andı pozmayıb əməl edin. (Allah-Təaladan başqasına and içmək batildir, gərək ancaq Allah-Təalaya olsun). **(اِنَّا وَجَدْنَاهُ صَابِرًاؕ نِعْمَ الْعَبْدُؕ اِنَّهُ اَوَّابٌ)** - (Ey Məhəmməd), **Eyyubla ona görə belə rəftar etdik ki, həqiqətən də, biz onu hər bir bəla və müsibətə səbir edən gördük. O səbəbdən onunla bu cür rəftar etdik. Nə yaxşı bəndə idi Eyyub və həqiqətən də, hər bir işində bizim tərəfimizə dönən idi.**

*(*Qeyd: "Allah Rəsulunun zamanında əli şikəst olan bir kişi bir kənizlə zina etdi, onu peyğəmbərin hüzuruna gətirdilər. Zina sübut ediləndən sonra əli şikəst olub, qadın da kəniz olduğu üçün Allahın Rəsulu buyurdu: "İçində 100 ədəd nazik xurma budağı olan bir dəst budaqla bir dəfə ona vurun ki, haqlarında olan cəza əmələ gəlsin". (Təfəkkür etmək lazımdır).*

**45) (وَاذْكُرْ عِبَادَنَآ اِبْرٰهِيمَ وَاِسْحٰقَ وَيَعْقُوبَ اُو۬لِي الْاَيْدٖي وَالْاَبْصَارِ)** - (Ey Məhəmməd), **yadına sal bizim bəndələrimiz olan İbrahim, İshaq və Yaqubu, onların xüsusiyyəti bu idi ki, həm zahiri əməlləri ilə, həm də batin fikirləri ilə Allah-Təalanın tövhid və qüdrətinə tabe olub, hər ikisinə agah idilər.** (Əməllərin əksəriyyəti insanın əllərilə meydana gəldiyinə görə Allah-Təala ayədə əlləri yad etdi).

**46) (اِنَّآ اَخْلَصْنَاهُمْ بِخَالِصَةٍ ذِكْرَى الدَّارِۚ)** - (Ey Məhəmməd), (O üç nəfər yad edilən peyğəmbəri) **onlarda var olan bir xalis sifətə görə özümüzə xalis bəndə seçdik. O sifət bu idi ki, həmişə axirəti yad edib, ölümdən qafil olmazdılar.** (Ölümü yad edən şəxs dünyaya çox meyil etməz. Dünyaya meyil etməyən şəxs dünya malını yığıb, ona etibar etməz, əksinə din və məzhəbin tərəqqisi yolunda, millətin övladlarının ehtiyac və arzusu, faydası yolunda sərf edər. Əlbəttə, belə şəxs Allah-Təalaya xalis bəndə hesab olunacaqdır).

**47) (وَاِنَّهُمْ عِنْدَنَا لَمِنَ الْمُصْطَفَيْنَ الْاَخْيَارِ) - Və həqiqətən, onlar bizim yanımızda insanlar içindən seçilmiş, hörmətə layiq şəxslərdirlər.**

**48) (وَاذْكُرْ اِسْمٰعٖيلَ وَالْيَسَعَ وَذَا الْكِفْلِؕ وَكُلٌّ مِنَ الْاَخْيَارِؕ ) - (**Ey **Məhəmməd), bu üç nəfər peyğəmbəri də yadına sal, bunların hamısı bəşəriyyətin içindən seçilmiş şəxslərdəndir.**

**49) (هٰذَا ذِكْرٌؕ)** - (Ey Məhəmməd), **bu peyğəmbərlərin əhvalatı ki, sənə bildirildi, Qurandan bir qisimdir. (Yəni Quran müxtəlif yönləri ilə səndən ötrü möcüzədir. Bir qismi də peyğəmbərlərin əhvalatıdır ki, səndən ötrü**

وَاِنَّ لِلْمُتَّقِينَ لَحُسْنَ مَاٰبٍۙ ﴿٤٩﴾ جَنَّاتِ عَدْنٍ مُفَتَّحَةً لَهُمُ الْاَبْوَابُۚ ﴿٥٠﴾ مُتَّكِـِٔينَ فِيهَا يَدْعُونَ
فِيهَا بِفَاكِهَةٍ كَثِيرَةٍ وَشَرَابٍ ﴿٥١﴾ وَعِنْدَهُمْ قَاصِرَاتُ الطَّرْفِ اَتْرَابٌ ﴿٥٢﴾ هٰذَا مَا تُوعَدُونَ لِيَوْمِ
الْحِسَابِ ﴿٥٣﴾ اِنَّ هٰذَا لَرِزْقُنَا مَا لَهُ مِنْ نَفَادٍۚ ﴿٥٤﴾ هٰذَاۜ وَاِنَّ لِلطَّاغِينَ لَشَرَّ مَاٰبٍۙ ﴿٥٥﴾ جَهَنَّمَ
يَصْلَوْنَهَاۚ فَبِئْسَ الْمِهَادُ ﴿٥٦﴾ هٰذَاۙ فَلْيَذُوقُوهُ حَمِيمٌ وَغَسَّاقٌۙ ﴿٥٧﴾ وَاٰخَرُ مِنْ شَكْلِهِ اَزْوَاجٌۜ ﴿٥٨﴾

---

**yad edilir. (وَاِنَّ لِلْمُتَّقِينَ لَحُسْنَ مَاٰبٍۙ) - Və həqiqətən,** (Ey Məhəmməd), **müttəqi şəxslərdən ötrü axirətdə gözəl mənzillər və qayıdacaq yerləri vardır.**

**50) (جَنَّاتِ عَدْنٍ مُفَتَّحَةً لَهُمُ الْاَبْوَابُ) - O evlər əbədi bağlardır ki, o bağların qapıları onlardan ötrü açıqdır. Ora daxil olmaqda onlara heç bir maneə yoxdur.**

**51) (مُتَّكِـِٔينَ فِيهَا) - O bağlara daxil olub taxtlara söykənib əyləşərlər, (يَدْعُونَ فِيهَا بِفَاكِهَةٍ كَثِيرَةٍ وَشَرَابٍ) - o taxtların üstündə əyləşəndən sonra onlara qulluq edən xidmətçiləri çağırıb, çoxlu miqdarda hər bir qisim meyvə və içəcək şeylər istəyərlər. O anda da hazır olar.**

**52) (وَعِنْدَهُمْ قَاصِرَاتُ الطَّرْفِ اَتْرَابٌ) - Onların yanında söhbət etməkdən ötrü - necə ki dünyada var, hurilər olar, hamısı da bir yaşdadır,** (bu çox yaxşıdır, daha heç kim o birisinə deyə bilməz ki, mənim yoldaşımın yaşı sənin yoldaşının yaşından azdır). **Özləri də gözlərini öz sahiblərinə dikib, başqasına iltifat etməzlər,** (doğrudan əcəb gözəl yerdir, kim nə istəsə, əziyyətsiz hazır olsun, belə yeri ağıllı şəxslər əldən verməzlər. Amma dünyada yemək-içməyə, evlənməyə həris olan şəxslərdən ötrü daha da yaxşıdır. Lakin heyif ki, onlara verilməyəcək, o dünyada onların ziddi onlara veriləcəkdir).

**53) (هٰذَا مَا تُوعَدُونَ لِيَوْمِ الْحِسَابِ) - Ey möminlər, bu yad edilən axirət nemətləri o şeylərdir ki, hesab (qiyamət) günündə sizə vəd edilir, belə bir neməti əldə etməyə səy edin ki, axirətdə sizdən ötrü hazır olsun.**

**54) (اِنَّ هٰذَا لَرِزْقُنَا مَا لَهُ مِنْ نَفَادٍۚ) - Ey möminlər, bu yad edilən nemətlər bizim ruzilərimizdir ki, onun sonu yoxdur. Əksinə, əbədiyyən mövcuddur.**

**55) (هٰذَاۜ وَاِنَّ لِلطَّاغِينَ لَشَرَّ مَاٰبٍۙ) - Ey möminlər, sizə verilən nemətlərə ki, agah oldunuz, indi baxın, görün, müşrik və asilərdən ötrü nə əzablar vardır.**

**56) (جَهَنَّمَ يَصْلَوْنَهَاۚ فَبِئْسَ الْمِهَادُ) - O mənzillər cəhənnəmdir, oraya daxil olarlar. Onlardan ötrü cəhənnəm nə yaman döşənib, hazır olan yerdir.**

**57) (هٰذَاۙ فَلْيَذُوقُوهُ حَمِيمٌ وَغَسَّاقٌ) - Budur cəhənnəm əzabı, gərək, onu dadsınlar, son dərəcədə hərarətli su və cəhənnəm əhlinin bədənlərindən axan çirkləri, gərək, içsinlər.**

**58) (وَاٰخَرُ مِنْ شَكْلِهِ اَزْوَاجٌ) - Elə xəyal olunmasın ki, cəhənnəm əzabı ancaq bu şeylərdən ibarətdir. Bəlkə, o əzablardan başqa da onlar kimi şiddətli neçə cür əzablar vardır ki, hamısını dadacaqlar.**

هٰذَا فَوْجٌ مُقْتَحِمٌ مَعَكُمْ ۚ لَا مَرْحَبًا بِهِمْ ۗ اِنَّهُمْ صَالُوا النَّارِ ﴿٥٩﴾ قَالُوا بَلْ اَنْتُمْ ۜ لَا مَرْحَبًا بِكُمْ ۗ اَنْتُمْ
قَدَّمْتُمُوهُ لَنَا ۚ فَبِئْسَ الْقَرَارُ ﴿٦٠﴾ قَالُوا رَبَّنَا مَنْ قَدَّمَ لَنَا هٰذَا فَزِدْهُ عَذَابًا ضِعْفًا فِي النَّارِ ﴿٦١﴾ وَقَالُوا مَا
لَنَا لَا نَرٰى رِجَالًا كُنَّا نَعُدُّهُمْ مِنَ الْاَشْرَارِ ۜ ﴿٦٢﴾ اَتَّخَذْنَاهُمْ سِخْرِيًّا اَمْ زَاغَتْ عَنْهُمُ الْاَبْصَارُ ﴿٦٣﴾
اِنَّ ذٰلِكَ لَحَقٌّ تَخَاصُمُ اَهْلِ النَّارِ ۟ ﴿٦٤﴾ قُلْ اِنَّمَآ اَنَا۬ مُنْذِرٌ ۗ وَمَا مِنْ اِلٰهٍ اِلَّا اللّٰهُ الْوَاحِدُ الْقَهَّارُ ۚ ﴿٦٥﴾

---

**59) (هٰذَا فَوْجٌ مُقْتَحِمٌ مَعَكُمْ) - Elə ki, qiyamət günü xalqı zəlalətə salan rəislər cəhənnəmə daxil olarlar, onların dalınca onlara tabe olanları da cəhənnəmə daxil edəndə rəislər özlərinə tabe olanlara baxıb bir-birilərinə deyərlər: "Budur bunlar da böyük bir dəstə ilə sizinlə birlikdə cəhənnəm əzabına daxil olurlar. (لَا مَرْحَبًا بِهِمْ ۗ اِنَّهُمْ صَالُوا النَّارِ) - Bunlara vüsət və rahatlıq olmasın. Onlar da cəhənnəm oduna daxil olarlar.** (Əlbəttə onlardan ötrü rahat olmaz).

**60) (قَالُوا بَلْ اَنْتُمْ ۜ لَا مَرْحَبًا بِكُمْ) - Tabe olanlar rəislərinin cavabında deyərlər: "Kaş sizə vüsət və rahatlıq olmasın. (اَنْتُمْ قَدَّمْتُمُوهُ لَنَا ۚ فَبِئْسَ الْقَرَارُ) - Siz bizim küfr və şirkimizə bais olub, əzaba layiq olan əməllərə səbəb oldunuz. İndi bizə tənə edirsiniz? Biz və siz, hər ikimiz, cəhənnəmə daxil olduq və nə yaman yerdir bu cəhənnəm".**

**61) (قَالُوا رَبَّنَا مَنْ قَدَّمَ لَنَا هٰذَا فَزِدْهُ عَذَابًا ضِعْفًا فِي النَّارِ) - Ondan sonra tabe olanlar rəislərdən ötrü yaman dua etməyə başlayıb deyərlər: "Ey bizim rəbbimiz, kim ki, bizi dünyada zəlalətə salıb bizim bu əzablara düçar olmamıza bais oldu, bu cəhənnəm odunda ona çoxlu əzab et."**

**62) (وَقَالُوا مَا لَنَا لَا نَرٰى رِجَالًا كُنَّا نَعُدُّهُمْ مِنَ الْاَشْرَارِ ۜ) - Ondan sonra cəhənnəm əhli baxıb dünyada istehza etdikləri möminləri görməyəndə bir-birilərinə deyərlər: "Hanı o kişilər** (möminlər) **ki, dünyada biz onları şərir şəxslərdən hesab edirdik. İndi burda onları görmürük".**

**63) (اَتَّخَذْنَاهُمْ سِخْرِيًّا) - Dünyada onlara məsxərə və istehza edirdik. İndi onları burda görmürük. Görəsən, behiştə gediblər?**

**(اَمْ زَاغَتْ عَنْهُمُ الْاَبْصَارُ) - Ya da ki buradadırlar, cəhənnəmə daxil olanda vəhşətdən gözlərimiz onları görməyibdir".**

**64) (اِنَّ ذٰلِكَ لَحَقٌّ تَخَاصُمُ اَهْلِ النَّارِ ۟)** - (Ey Məhəmməd), **cəhənnəm əhlinin bu şəkildə bir-biri ilə düşmənçilik edib dalaşmaları haqdır, əlbəttə vaqe olacaqdır.**

**65) (قُلْ اِنَّمَآ اَنَا۬ مُنْذِرٌ ۗ وَمَا مِنْ اِلٰهٍ اِلَّا اللّٰهُ الْوَاحِدُ الْقَهَّارُ)** - (Ey Məhəmməd), **xalqa de ki, həqiqətən, mən sizi Allah-Təala tərəfindən qorxutmaq üçün gəlmişəm, yeganə və cəmi məxluqata qalib olan Allah-Təaladan başqa heç bir nəfər haqq məbud yoxdur.**

رَبُّ السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَيْنَهُمَا الْعَزِيزُ الْغَفَّارُ ﴿٦٦﴾ قُلْ هُوَ نَبَؤٌا عَظِيمٌ ۙ ﴿٦٧﴾ اَنْتُمْ عَنْهُ
مُعْرِضُونَ ﴿٦٨﴾ مَا كَانَ لِيَ مِنْ عِلْمٍ بِالْمَلَاِ الْاَعْلٰى اِذْ يَخْتَصِمُونَ ﴿٦٩﴾ اِنْ يُوحٰى اِلَيَّ اِلَّا اَنَّمَٓا
اَنَا۬ نَذِيرٌ مُبِينٌ ﴿٧٠﴾ اِذْ قَالَ رَبُّكَ لِلْمَلٰٓئِكَةِ اِنّ۪ي خَالِقٌ بَشَرًا مِنْ طِينٍ ﴿٧١﴾ فَاِذَا سَوَّيْتُهُ وَنَفَخْتُ
ف۪يهِ مِنْ رُوح۪ي فَقَعُوا لَهُ سَاجِد۪ينَ﴿٧٢﴾ فَسَجَدَ الْمَلٰٓئِكَةُ كُلُّهُمْ اَجْمَعُونَ ۙ ﴿٧٣﴾ اِلَّٓا اِبْل۪يسَ ۜ اِسْتَكْبَرَ
وَكَانَ مِنَ الْكَافِر۪ينَ﴿٧٤﴾

---

**66) (رَبُّ السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَيْنَهُمَا الْعَزِيزُ الْغَفَّارُ) - Göylərin yerin və onların arasında olan şeylərin rəbbi** (tərbiyə verəni), **asilərə əzab edən, məğlub olmayan və tövbəkarları bağışlayan Allah-Təaladan başqa məbud yoxdur. Gəlin bütləri tərk edib, belə Allah-Təalaya sitayiş edin.**

**67-68) (قُلْ هُوَ نَبَؤٌا عَظِيمٌ ۙ اَنْتُمْ عَنْهُ مُعْرِضُونَ) -** (Ey Məhəmməd), **xalqa de ki, bu Quran böyük və faydalı bir xəbərdir. Allah-Təaladan sizə bu xəbəri gətirmişəm, ağıllı şəxs gərək onu qəbul etsin. Amma siz ondan üz döndərirsiniz. Bunungla belə özünüzü ağıllı sayırsınız.**

**69) (مَا كَانَ لِيَ مِنْ عِلْمٍ بِالْمَلَاِ الْاَعْلٰى اِذْ يَخْتَصِمُونَ) -** (Peyğəmbər deyir:) **ey camaat, uca mərtəbəli və şərəfli şəxslərin** (məlaikənin) **əhvalı haqqında mənim elmim yox idi, hansı ki, o zaman onların arasında** (Allah-Təala ilə məlaikə arasında Adəmin yaradılması haqqında) **mübahisə oldu, o söz-söhbəti mənə Allah-Təala vəhy edibdir.**

**70) (اِنْ يُوحٰى اِلَيَّ اِلَّا اَنَّمَٓا اَنَا۬ نَذِيرٌ مُبِينٌ) - O söz-söhbət mənə Allah-Təala tərəfindən ancaq ona görə vəhy olunur ki, həqiqətən, mən sizi Allah-Təalanın əzabından açıq-aşkar qorxudanam, ta ki, Allah-Təalanın əzabını və qəhr edən gücünü sizə xəbər verim, bəlkə qorxub itaət edəsiniz.** (O söz-söhbət budur ki, Allah-Təala xəbər verir).

**71) (اِذْ قَالَ رَبُّكَ لِلْمَلٰٓئِكَةِ اِنّ۪ي خَالِقٌ بَشَرًا مِنْ طِينٍ) -** (Ey Məhəmməd), **o zaman ki, sənin rəbbin Allah-Təala məlaikəyə xitab edib dedi: "Həqiqətən, mən palçıqdan bir insan yaradacam".**

**72) (فَاِذَا سَوَّيْتُهُ وَنَفَخْتُ ف۪يهِ مِنْ رُوح۪ي فَقَعُوا لَهُ سَاجِد۪ينَ) - O zaman ki mən o insanın (Adəmin) bədənini düzəldib, yaradılışını tamamlayıb, öz ruhumdan ona üflədim, hamınız yıxılıb ona səcdə etdiniz.**

**73-74) (فَسَجَدَ الْمَلٰٓئِكَةُ كُلُّهُمْ اَجْمَعُونَ اِلَّٓا اِبْل۪يسَ ۜ اِسْتَكْبَرَ وَكَانَ مِنَ الْكَافِر۪ينَ) -** (Ey Məhəmməd), **mələklərin hamısı itaət edib Adəmə səcdə etdilər, ancaq şeytan təkəbbürlənib, səcdə etməyib kafirlərdən oldu.** (Cəmi gözəl xüsusiyyətlər Adəmə səcdə və itaət edib, ancaq şəri əmr edən xəbis nəfs asi oldu. Bu mətləbə təfsilatlı şəkildə keçən surələrdə işarə olunubdur).

قَالَ يَآ اِبْلِيسُ مَا مَنَعَكَ اَنْ تَسْجُدَ لِمَا خَلَقْتُ بِيَدَيَّ ۗ اَسْتَكْبَرْتَ اَمْ كُنْتَ مِنَ الْعَالِينَ ﴿٧٥﴾ قَالَ اَنَا۠
خَيْرٌ مِنْهُ ۗ خَلَقْتَنِي مِنْ نَارٍ وَخَلَقْتَهُ مِنْ طِينٍ﴿٧٦﴾ قَالَ فَاخْرُجْ مِنْهَا فَاِنَّكَ رَجِيمٌ ۚ﴿٧٧﴾ وَاِنَّ عَلَيْكَ
لَعْنَتِيٓ اِلٰى يَوْمِ الدِّينِ﴿٧٨﴾ قَالَ رَبِّ فَاَنْظِرْنِيٓ اِلٰى يَوْمِ يُبْعَثُونَ ﴿٧٩﴾ قَالَ فَاِنَّكَ مِنَ الْمُنْظَرِينَ ۙ
﴿٨٠﴾ اِلٰى يَوْمِ الْوَقْتِ الْمَعْلُومِ﴿٨١﴾

---

**75) (قَالَ يَآ اِبْلِيسُ مَا مَنَعَكَ اَنْ تَسْجُدَ لِمَا خَلَقْتُ بِيَدَيَّ) - Allah-Təala buyurdu: "Ey şeytan, mənim öz əllərimlə yaratdığım məxluqa səcdə etməkdən sənə nə mane oldu?** (Allah-Təala insanlığın adəti üzrə öz əməlini əllərinə isnad edir). **(اَسْتَكْبَرْتَ اَمْ كُنْتَ مِنَ الْعَالِينَ) Təkəbbür səbəbi ilə səcdə etmədin, yoxsa uca və üstün mərtəbədə** (düşünən nəfs və ağıl gücü mərtəbəsində) **olanlardan idin?**

**76) (قَالَ اَنَا۠ خَيْرٌ مِنْهُ ۗ خَلَقْتَنِي مِنْ نَارٍ وَخَلَقْتَهُ مِنْ طِينٍ) - Şeytan təkəbbürlənməsini bəyan edib dedi: "Mən Adəmdən yaxşıyam, məni** (şəri əmr edən xəbis nəfsi) **oddan yaradıbsan, Adəmi palçıqdan. Od palçıqdan şərəflidir, mən ona necə səcdə edim?"**

**77) (قَالَ فَاخْرُجْ مِنْهَا فَاِنَّكَ رَجِيمٌ) - Allah-Təala şeytanın cavabında dedi: "İndi ki, sən təkəbbürləndin, cənnətdən** (müqəddəs məqamdan) **çıx. Həqiqətən, sən bizim rəhmətimizdən uzaq və kənar olmusan.**

**78) (وَاِنَّ عَلَيْكَ لَعْنَتِيٓ اِلٰى يَوْمِ الدِّينِ) - Qovulmaqdan əlavə mənim lənətim qiyamətə kimi sənə aiddir. Səndən ötrü nicat olmayacaqdır.**

**79) (قَالَ رَبِّ فَاَنْظِرْنِيٓ اِلٰى يَوْمِ يُبْعَثُونَ) - Şeytan dedi: "Ey mənim rəbbim, indi ki, məni rəhmətindən kənar etdin, insanlar yenidən dirilib, məhşərdə hazır olan günə kimi mənə möhlət və ömür ver."**

**80-81) (قَالَ فَاِنَّكَ مِنَ الْمُنْظَرِينَ اِلٰى يَوْمِ الْوَقْتِ الْمَعْلُومِ) - Allah-Təala şeytana cavab verib dedi: "Bizim yanımızda cəmi məxluqatın həlak olacağı məlum vaxtın gününə kimi, həqiqətən, sən möhlət verilənlərdənsən. O vaxta kimi sənə möhlət verilib, sənin üçün fanilik olmayacaqdır.** (İnsan nəsli yer üzündə qaldıqca, şəri əmr edən xəbis nəfs hər bir fərddə özünə yer edib, hər bir şəxsdə bir şeytan sifətilə mövcud olacaqdır. Qiyamətin qopması ilə yer kürəmiz məhv olandan sonra, insan nəsli də qalmayacağı üçün şəri əmr edən xəbis nəfsin vaqe olması imkansız işlərdən olub, insanlıq ilə birlikdə yox olacaqdır. Daha ondan sonra şeytandan ötrü sağ qalmaq imkansızdır və bu səbəbdən Allah-Təala ona yer kürəsi məhv olub, insanlar da yox olana qədər möhlət verir. Lakin şeytanın möhlət tələb etməkdən məqsədi əbədi yaşamaq olub, fani olmamaq idi. Təfəkkür etmək lazımdır).

قَالَ فَبِعِزَّتِكَ لَاُغْوِيَنَّهُمْ اَجْمَعِينَۙ ﴿٨٢﴾ اِلَّا عِبَادَكَ مِنْهُمُ الْمُخْلَصِينَ﴿٨٣﴾ قَالَ فَالْحَقُّۘ وَالْحَقَّ
اَقُولُ ﴿٨٤﴾ لَاَمْلَئَنَّ جَهَنَّمَ مِنْكَ وَمِمَّنْ تَبِعَكَ مِنْهُمْ اَجْمَعِينَ﴿٨٥﴾ قُلْ مَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ اَجْرٍ
وَمَٓا اَنَا۬ مِنَ الْمُتَكَلِّفِينَ ﴿٨٦﴾ اِنْ هُوَ اِلَّا ذِكْرٌ لِلْعَالَمِينَ ﴿٨٧﴾ وَلَتَعْلَمُنَّ نَبَاَهُ بَعْدَ حِينٍ ﴿٨٨﴾

---

**82-83) (قَالَ فَبِعِزَّتِكَ لَاُغْوِيَنَّهُمْ اَجْمَعِينَ اِلَّا عِبَادَكَ مِنْهُمُ الْمُخْلَصِينَ) - Şeytan dedi: "Mənim rəbbim, and olsun sənin izzətinə ki, Adəm övladının hamısını asi edib, sənin yolundan çıxaracam. Ancaq səndən ötrü dinlərində ixlaslı olan bəndələrini narahat etməyib, onları asi edə bilmərəm."**

**84-85) (قَالَ فَالْحَقُّۘ وَالْحَقَّ اَقُولُ لَاَمْلَئَنَّ جَهَنَّمَ مِنْكَ وَمِمَّنْ تَبِعَكَ مِنْهُمْ اَجْمَعِينَ) - Allah-Təala şeytana cavab verib dedi: "Mən özüm Haqqam və haqq söz də deyirəm. O haqq söz budur: "Sən ki, mənə asi oldun, əlbəttə, sənin özünü və sənə tabe olub mənə asi olanların hamısını cəhənnəmə dolduracağam. O vaxt görərsiniz, sizə necə əzab edəcəm."**

**86) (قُلْ مَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ اَجْرٍ وَمَٓا اَنَا۬ مِنَ الْمُتَكَلِّفِينَ) -** (Ey Məhəmməd), **müşriklərə de ki, Adəmlə şeytanın hekayəsini ki, eşitdiniz, siz də Adəm övladısınız, övlad gərək atanın düşmənini düşmən saysın. Gəlin, şeytanı tərk edib mənim sözümü** (Quranı) **qəbul edib Allah-Təalaya itaət edin. Mən bu "Quran"ın ehkamını sizə yetirmək üçün sizdən bir əcr və muzd istəmirəm ki, dünya malına görə məndən qaçasınız və bunu da bilirsiniz ki, əgər məndə bir şey olmasa, mən o şeyi özümə bağlayıb isnad edən deyiləm. Bu vaxta kimi sizin aranızda olmuşam. Əgər məndə olmayan şeyi iddia eləmişəmsə, siz bilirsiniz. İndi ki, peyğəmbərlik iddiası edirəm, bunu özümdən etmirəm, əksinə Allah-Təala mənə peyğəmbərlik lütf edib, məni sizə rəhmətlə müjdələyən və əzabla qorxudan göndəribdir, möcüzə olaraq bu Quranı mənə bəxş edibdir.**

**87) (اِنْ هُوَ اِلَّا ذِكْرٌ لِلْعَالَمِينَ) - Bu Quran hər bir aləmdə meydana gələn insanlardan ötrü qiyamətə qədər ancaq öyüd-nəsihətdir. Onun ehkamına itaət etmək nicata səbəbdir.**

**88) (وَلَتَعْلَمُنَّ نَبَاَهُ بَعْدَ حِينٍ ) - İndi ki siz bu Quranı inkar edirsiniz, ey Məkkə əhli, amma bir zamandan sonra Quranın doğruluq və həqiqət olmasının xəbəri sizə yetişib, onun Allah-Təala tərəfindən olduğuna agah olacaqsınız.** (Elə ki, uca peyğəmbər (ə.s) Məkkədən Mədinəyə hicrət etdi, yavaş-yavaş islam yayılıb, Məkkə əhlinə bu xəbər yetişirdi və o xəbərlərdən qəmgin olurdular ki, islam onlara qalib gəlib, Məkkə islam idarəsinə keçdi, küfr və şirk məhv olub, müşriklər zəlil və məhv oldular və islamın haqlılığı aşkar oldu).

**Allaha həmd olsun, mübarək Sad surəsinin təfsiri tamamlandı. Nə gözəl incəlik və rəmzləri ehtiva edən surədir. Bu bəyənilən kitabı oxuyanlara ayələrin mənasına diqqət etmək tövsiyə olunur. Hidayətə və doğru yola götürən Allahdır. Allahın Rəsulu buyurubdur: “Kim Sad surəsini oxusa, Allah-Təala onu kiçik və böyük günahlara düçar olmaqdan mühafizə edər”. Bu hədisi təfəkkür etmək lazımdır. Sadəcə oxumaqla günahdan qorunmaq mümkündürmü?**

## əz-ZÜMƏR SURƏSİ

39-cu surədir. Məkkədə nazil olub, 72 ayə, 1172 kəlmə və 4907 hərfdir.

تَنْزِيلُ الْكِتَابِ مِنَ اللّٰهِ الْعَزِيزِ الْحَكِيمِ ﴿١﴾ اِنَّٓا اَنْزَلْنَٓا اِلَيْكَ الْكِتَابَ بِالْحَقِّ فَاعْبُدِ اللّٰهَ مُخْلِصًا لَهُ الدِّينَ
اَلَا لِلّٰهِ الدِّينُ الْخَالِصُ وَالَّذِينَ اتَّخَذُوا مِنْ دُونِه۪ٓ اَوْلِيَٓاءَ مَا نَعْبُدُهُمْ اِلَّا لِيُقَرِّبُونَٓا اِلَى اللّٰهِ زُلْفٰى اِنَّ اللّٰهَ
يَحْكُمُ بَيْنَهُمْ ف۪ي مَا هُمْ ف۪يهِ يَخْتَلِفُونَ ﴿٢﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (تَنْزِيلُ الْكِتَابِ مِنَ اللّٰهِ الْعَزِيزِ الْحَكِيمِ) -** (Ey Məhəmməd), **bu Quran cəmi məxluqa qalib olub hər bir işi hikmət üzrə edən Allah-Təala tərəfindən nazil olubdur. Belə bir kitaba şübhə etmək doğru deyildir.**

**2) (اِنَّٓا اَنْزَلْنَٓا اِلَيْكَ الْكِتَابَ بِالْحَقِّ) -** (Ey Məhəmməd), **həqiqətən, biz bu Quranı haqq və ədalət üzrə sənə göndərdik, boş və əbəs yerə göndərməmişik. (فَاعْبُدِ اللّٰهَ مُخْلِصًا لَهُ الدِّينَ) - Dinini Allah-Təalaya məxsus etdiyin halda Allah-Təalaya ibadət et ki, belə bir hikmət və vəzi ehtiva edən kitabı sənə göndəribdir. (اَلَا لِلّٰهِ الدِّينُ الْخَالِصُ) -** (Xəbərdar ol, ey Məhəmməd) **özündə şirk və riya olmayan xalis din Allah-Təalaya layiq və məxsudur.**

**(وَالَّذِينَ اتَّخَذُوا مِنْ دُونِه۪ٓ اَوْلِيَٓاءَ) - O şəxslər ki, Allah-Təaladan başqasını özünə dost və məbud seçib, onlara ibadət edirlər, (مَا نَعْبُدُهُمْ اِلَّا لِيُقَرِّبُونَٓا اِلَى اللّٰهِ زُلْفٰى) - ibadət etdikləri üçün bəhanə gətirib deyirlər: "Biz o məbudlara (bütlərə) ancaq bizi Allah-Təalaya yaxınlaşdırıb, bizdən* ötrü şəfaət etmələri üçün ibadət edirik. (اِنَّ اللّٰهَ يَحْكُمُ بَيْنَهُمْ ف۪ي مَا هُمْ ف۪يهِ يَخْتَلِفُونَ) - Həqiqətən, o işdə ki,** (Allah-Təalanın tövhidində) **ixtilaf edirdilər, Allah-Təala** (qiyamət) **günündə o işin barəsində onların arasında hökm edəcəkdir.** (Ey Məhəmməd, sən onlara deyirdin: "Allah-Təalaya şirk qoşmayın, onlar sənə xilaf çıxıb deyirdilər: "Bu şəriklər bizi Allah-Təalaya yaxınlaşdırıb, bizim üçün şəfaət edəcəklər)".

*(*Qeyd: "İslam ümmətinin əhvalı, millət və məzhəb rəislərini hərçənd zahirdə Allah-Təalaya şərik saymırlar, lakin həqiqətən, ehtiyac anında onları özlərinə qiblə, şəfaətçi sayıb, axirət nicatlarını onların şəfaətinə məxsus etmək şirk deyilmi? Nəinki rəisləri, bəlkə hər bir seyidə, zahid və sufiyə şəfaət ümidi ilə bağlanıb, Allah-Təalanı unudub, Qurani-Şərifin ehkamından bixəbər olublar və halbuki məhşər günü onlarla ilk düşmənçilik edən elə bu rəislərin özləri olacaqlar. Baxıb görürsən ki, islamdan bir qrup əmirəl-möminin Əli ibn Əbu Talibin təəssübünü çəkib, onun imamlığı üçün dəlillər gətirib, ondan*

إِنَّ اللّٰهَ لَا يَهْدِي مَنْ هُوَ كَاذِبٌ كَفَّارٌ ﴿٣﴾ لَوْ اَرَادَ اللّٰهُ اَنْ يَتَّخِذَ وَلَدًا لَاصْطَفٰى مِمَّا يَخْلُقُ مَا يَشَٓاءُ
سُبْحَانَهُ هُوَ اللّٰهُ الْوَاحِدُ الْقَهَّارُ ﴿٤﴾

---

*başqasının imamlığına və fəzilətinə inananları təkfir edib, zındıq və mürtəd hesab edirlər, ancaq özlərini qurtulmuş camaat sayırlar. Amma diqqətlə təfəkkür edəndə o cənabın əməl, rəftar və sözlərindən o camaatda bir iz görülmür. Əksinə, o ulu şəxsin yolunun ziddi onlardan zahir olur, habelə islamdan bir qrup da, görürsən ki, I xəlifə Əbu Bəkrin təəssübünü çəkib, Allahın Rəsulundan sonra ona ən fəzilətli səhabə deyirlər, ona müxalif olanları, Əbu Bəkri ən fəzilətli saymayanları, ya da ki, imamlıq (hakimiyyət) nəs (ilahi əmr) ilədir deyənləri islamdan kənar və rədd edilmiş sayıb, ancaq özlərini haqq camaat hesab edirlər. Halbuki insafla baxanda o Siddiqin (Əbu Bəkr əs-Siddiq) əməllərindən onlarda heç bir şey müşahidə olunmur. Məhşər günü onların ilk düşməni Əli və Əbu Bəkir olacaqdır. İslam ümməti əsl məqsədi yaddan çıxarıb, ömürlərini daxili mücadilələrdə çürüdüb, parçalanıb, özlərini zəlil və aciz edib. İslam ümmətinin əsası belə qoyulmuşdu? Təqva (Allah qorxusu) ilə əsası qoyulan islam bugünkü gündə belə dava-dalaş çıxaranların düşmənçilik və ədavət baltası ilə viran olubdur. İslam ümmətinin bu günkü gündə ilk vəzifəsi o müqəddəs binanın təmirinə və möhkəmlənməsinə səy və cəhd etməkdir. İlk gündən müsəlmanlar arasına təfriqə salan çərənçilərin və din düşmənlərinin əsərlərini yandırıb, onların ortaya qoyduğu xəbis əxlaqı Qurani-Şərifin gözəl əxlaqı ilə əvəz etmək lazımdır. İslam ümmətinin yenidən dirilib: "Qəbirlərindən qalxıb, sürətlə rəblərinə tərəf qaçarlar" ayəsinin təsdiqi üçün səy və cəhd etməsi ilk dini fərzlərdən hesab olunmalıdır. İslam ümmətini bu cəhalət və fəlakətə salan şey ilk yad etdiyimiz daxili mücadilədən başqa bir şey deyildir. Yuxarıda bəhs etdiyim kəslərdən – yandırılması vacib olan əsərlərin sahibi olan islam düşmənlərindən məqsədim müsəlmanların xaricindəki millətlər deyildir. Əksinə, məqsədim - islam ümmətinin özlərinə imam və rəis saydığı, lakin öz faydasını güdüb, millət və islam əleyhinə kitablar yazan, müsəlmanları bir-birinə zidd və düşmən edən şəxsləri ifşa etməkdir. İşin həqiqətinə agah olub, hənif dini olan islamın yaranması, xüsusiyyəti və yayılması, ondan sonra geriyə gedib, zəifləməsi və süqutu haqqında məlumatı olan və bu işdə rolu olanları tanıyan fəzilətli və alim şəxslərə mən həqirin məqsədi aydındır. Bu məqamda bundan artıq kəlama ehtiyac olmayıb, sözü uzatmayım. Bugünkü gündə islam ümmətinin əhvalının qeyrətli və dinini sevən alimləri dəli-divanə etməsi təəccüblü deyildir. Allah ən yaxşı köməkçidir).*

**3-4) (إِنَّ اللّٰهَ لَا يَهْدِي مَنْ هُوَ كَاذِبٌ كَفَّارٌ)** - (Ey Məhəmməd), **Allah həqiqətən, özünə şərik və övlad nisbət edən kafirləri haqq tərəfinə hidayət etməz. (لَوْ اَرَادَ اللّٰهُ اَنْ يَتَّخِذَ وَلَدًا لَاصْطَفٰى مِمَّا يَخْلُقُ مَا يَشَٓاءُ) - Əgər Allah-Təala özü üçün övlad götürmək istəsəydi, istədiyini seçib özünə övlad edərdi. (سُبْحَانَهُ هُوَ اللّٰهُ الْوَاحِدُ الْقَهَّارُ) - Lakin Allah-Təala övlad götürməkdən pak və**

خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ بِالْحَقِّۚ يُكَوِّرُ الَّيْلَ عَلَى النَّهَارِ وَيُكَوِّرُ النَّهَارَ عَلَى الَّيْلِ وَسَخَّرَ الشَّمْسَ
وَالْقَمَرَۜ كُلٌّ يَجْرِي لِاَجَلٍ مُسَمًّىۜ اَلَا هُوَ الْعَزِيزُ الْغَفَّارُ ﴿٥﴾ خَلَقَكُمْ مِنْ نَفْسٍ وَاحِدَةٍ ثُمَّ جَعَلَ
مِنْهَا زَوْجَهَا وَاَنْزَلَ لَكُمْ مِنَ الْاَنْعَامِ ثَمَانِيَةَ اَزْوَاجٍۜ يَخْلُقُكُمْ فِي بُطُونِ اُمَّهَاتِكُمْ خَلْقًا مِنْ بَعْدِ خَلْقٍ
فِي ظُلُمَاتٍ ثَلٰثٍۜ ذٰلِكُمُ اللّٰهُ رَبُّكُمْ لَهُ الْمُلْكُۜ لَٓا اِلٰهَ اِلَّا هُوَۚ فَاَنّٰى تُصْرَفُونَ ﴿٦﴾

---

**müqəddəsdir. Bu sifət Allah-Təalaya layiq sifət deyildir. Övlad üçün cismanilik və evlilik lazımdır. Evlilikdə də cinsiyyət və bənzərlik şərtdir. Lakin Allah-Təala vahid və yeganə, cismanilik və cinsiyyətdən uzaq olub külli məxluqata qalib, qüdrətində kamil, müqəddəs bir varlıqdır və bu səbəbdən ona övlad isnad etmək rəva deyildir.**

**5) (خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ بِالْحَقِّ) - Allah-Təala öz kamil qüdrəti ilə göyləri və yeri haqq və doğru qayə üzrə yaratdı. (يُكَوِّرُ الَّيْلَ عَلَى النَّهَارِ وَيُكَوِّرُ النَّهَارَ عَلَى الَّيْلِ) - Gecəni gündüzə və gündüzü gecəyə qatıb, bir-birindən aralanmayıb, həmişə bir-birinin dalınca vaqe olurlar. (وَسَخَّرَ الشَّمْسَ وَالْقَمَرَۜ كُلٌّ يَجْرِي لِاَجَلٍ مُسَمًّىۜ) - Əzəmətli günəş və ayı öz qüdrətinə tabe edib, onlardan ötrü təyin etdiyi müəyyən vaxta kimi hərəkət edərlər. Elə ki, o müəyyən vaxt yetişdi, dağılıb yox olacaqlar. (اَلَا هُوَ الْعَزِيزُ الْغَفَّارُ)** - (Ey Məhəmməd), **xəbərdar ol ki, Allah-Təala küfr və şirkdə israr edib qalanlara əzab etməyə, onlardan intiqam almaqda qalibdir və tövbə edənlərin tövbəsini qəbul edib günahlarını bağışlayandır.** (Görəsən, bu yad olunan sifətlər Allah-Təalanın tövhid və qüdrətinə işarə etməzmi?)

**6) (خَلَقَكُمْ مِنْ نَفْسٍ وَاحِدَةٍ ثُمَّ جَعَلَ مِنْهَا زَوْجَهَا) - Allah-Təala öz kamil qüdrəti ilə siz insan nəslini bir tək atadan** (Adəmdən) **yaradıb, sizi yer üzünə yaydı. Adəmi yaradandan sonra onun təbiətindən də xanımı Həvvanı yaratdı. (وَاَنْزَلَ لَكُمْ مِنَ الْاَنْعَامِ ثَمَانِيَةَ اَزْوَاجٍۜ) - Allah-Təala öz kamil qüdrətini uca məqamlardan yer üzünə göndərib, sizdən ötrü* səkkiz baş, 4 ayaqlı heyvan** (dəvə, inək, qoyun və keçi) **yaratdı. Hansı ki onları həm yeyib, həm də minib yük daşıtdırmaqla faydalanırsınız.**

**(يَخْلُقُكُمْ فِي بُطُونِ اُمَّهَاتِكُمْ خَلْقًا مِنْ بَعْدِ خَلْقٍ فِي ظُلُمَاتٍ ثَلٰثٍۜ) - Allah-Təala siz insanları analarınızın qarnında, 3 qaranlığın içində** (ananın qarnı, bətni və bətnin daxilində olan örtükdə)** **yaradıb, sonra insan surətinə daxil etdi. Belə Allah-Təalaya şirk qoşursunuz? (ذٰلِكُمُ اللّٰهُ رَبُّكُمْ لَهُ الْمُلْكُۜ لَٓا اِلٰهَ اِلَّا هُوَۚ فَاَنّٰى تُصْرَفُونَ) -Sizin rəbbiniz belə qüdrət sahibi Allah-Təaladır. Hər bir şeyin ixtiyarı və hakimiyyəti ona məxsusdur. Ondan başqa haqq məbud yoxdur. Nəfsiniz belə Allah-Təalanın ibadət və itaətindən sizi hara döndərir və belə Allah-Təalaya nəyi şərik sayırsınız?**

*(*Qeyd: "Bəhs olunan 4 heyvan erkək və dişi olaraq, 8 baş hesab olunur).*

إِنْ تَكْفُرُوا فَإِنَّ اللّٰهَ غَنِيٌّ عَنْكُمْ وَلَا يَرْضٰى لِعِبَادِهِ الْكُفْرَ ۚ وَاِنْ تَشْكُرُوا يَرْضَهُ لَكُمْ ۗ وَلَا تَزِرُ وَازِرَةٌ وِزْرَ اُخْرٰى ۗ ثُمَّ اِلٰى رَبِّكُمْ مَرْجِعُكُمْ فَيُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ تَعْمَلُونَ ۗ اِنَّهُ عَلِيمٌ بِذَاتِ الصُّدُورِ ﴿٧﴾ وَاِذَا مَسَّ الْاِنْسَانَ ضُرٌّ دَعَا رَبَّهُ مُنِيبًا اِلَيْهِ ثُمَّ اِذَا خَوَّلَهُ نِعْمَةً مِنْهُ نَسِيَ مَا كَانَ يَدْعُوا اِلَيْهِ مِنْ قَبْلُ وَجَعَلَ لِلّٰهِ اَنْدَادًا لِيُضِلَّ عَنْ سَبِيلِهِ ۗ قُلْ تَمَتَّعْ بِكُفْرِكَ قَلِيلًا ۚ اِنَّكَ مِنْ اَصْحَابِ النَّارِ ﴿٨﴾

---

*(**Qeyd: "İnsan əvvəlcə sperma halında olub, ondan sonra Allah-Təala həmin spermaya dəyişiklik verərək bətndə təyin etdiyi dəyişiklik səbəbi ilə bir parça ət edir, ondan sonra bətndə təyin etdiyi inkişaf qüvvəsi səbəbi ilə həmin parça ətin həcmini böyüdüb, onda sümük və digər əzalar yaradıb, onu gözəl insan surətinə daxil edir. "Yaradanların ən yaxşısı olan Allahın nə xeyirli işləri var!").*

**7) (اِنْ تَكْفُرُوا فَاِنَّ اللّٰهَ غَنِيٌّ عَنْكُمْ) - Əgər siz insanlar Allah-Təalaya kafir olub, ona şərik qoşsanız, həqiqətən, Allah-Təalanın sizin özünüzə və imanınıza ehtiyacı yoxdur. İman sizə mənfəət verdiyi üçün Allah-Təalaya möhtacsınız. (وَلَا يَرْضٰى لِعِبَادِهِ الْكُفْرَ) - Allah-Təala öz bəndələrinin küfr və şirkinə razı olmaz. Bəlkə bəndələr özləri öz iradələri ilə küfrü imana üstün sayıb kafir olarlar. (وَاِنْ تَشْكُرُوا يَرْضَهُ لَكُمْ) - Əgər Allah-Təalaya şükür edib, iman etsəniz, sizin şükrünüzə razı olub ondan ötrü sizə mükafat verəcəkdir. (وَلَا تَزِرُ وَازِرَةٌ وِزْرَ اُخْرٰى) - Heç bir günahkar nəfs başqa bir günahkar nəfsin günahını yüklənib, onun yükünü çəkməz. Hər bir nəfsə qiyamət günündə öz əməlinin cəzası verilər. (ثُمَّ اِلٰى رَبِّكُمْ مَرْجِعُكُمْ فَيُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ تَعْمَلُونَ) - Dünyada ölüm sizə gələndən sonra qayıdacağınız yer rəbbiniz Allah-Təala tərəfinə olub, dünyada etdiyiniz əməlləri sizə xəbər verib, həmin əməllərin cəzasını sizə verəcəkdir. (اِنَّهُ عَلِيمٌ بِذَاتِ الصُّدُورِ) - Həqiqətən, Allah-Təala sinələrdə və qəlblərdə olan sirlərə agahdır. Hər bir şəxsin qəlbinin içinə görə onunla rəftar edəcəkdir.**

**8) (وَاِذَا مَسَّ الْاِنْسَانَ ضُرٌّ دَعَا رَبَّهُ مُنِيبًا اِلَيْهِ)** - (Ey Məhəmməd), **insanın sifətlərini səndən ötrü bəyan edim, o zaman ki, insana bir bəla və müsibət yetişdi, öz rəbbi Allah-Təala tərəfinə qayıdıb, ona dua edib, o bəla və dərdin dəf edilməsini Allah-Təaladan istəyər. (ثُمَّ اِذَا خَوَّلَهُ نِعْمَةً مِنْهُ) Allah-Təala onun müraciətini, duasını qəbul edib, bəlanı ondan dəf edib, öz tərəfindən ona nemət bəxş etdi. (نَسِيَ مَا كَانَ يَدْعُوا اِلَيْهِ مِنْ قَبْلُ) -O ki, nemətdən əvvəl ona yetişən bəlanın dəf edilməsi üçün Allah-Təalaya dua edib, bəlanın dəf edilməsini istəmişdi və Allah-Təala da onun duasını qəbul edib, bəlanı dəf etmişdi, o, bunların hamısını yaddan çıxarar. (وَجَعَلَ لِلّٰهِ اَنْدَادًا لِيُضِلَّ عَنْ سَبِيلِهِ) -Və Allah-Təalaya şəriklər qoşub, onlara sitayiş edər ki, o şəriklərin səbəbinə xalqı da Allah-Təalanın yolundan azdırıb, iman əvəzinə zəlalətə salsın.**

**(قُلْ تَمَتَّعْ بِكُفْرِكَ قَلِيلًا ۚ اِنَّكَ مِنْ اَصْحَابِ النَّارِ)** - (Ey Məhəmməd), **belə kafirə de ki,**

اَمَّنْ هُوَ قَانِتٌ اٰنَآءَ الَّيْلِ سَاجِدًا وَقَٓائِمًا يَحْذَرُ الْاٰخِرَةَ وَيَرْجُوا رَحْمَةَ رَبِّهٖۜ قُلْ هَلْ يَسْتَوِي الَّذٖينَ يَعْلَمُونَ
وَالَّذٖينَ لَا يَعْلَمُونَۜ اِنَّمَا يَتَذَكَّرُ اُو۬لُوا الْاَلْبَابِ ﴿٩﴾ قُلْ يَا عِبَادِ الَّذٖينَ اٰمَنُوا اتَّقُوا رَبَّكُمْۜ لِلَّذٖينَ اَحْسَنُوا
فٖي هٰذِهِ الدُّنْيَا حَسَنَةٌۜ وَاَرْضُ اللّٰهِ وَاسِعَةٌۜ اِنَّمَا يُوَفَّى الصَّابِرُونَ اَجْرَهُمْ بِغَيْرِ حِسَابٍ ﴿١٠﴾ قُلْ اِنّٖٓي
اُمِرْتُ اَنْ اَعْبُدَ اللّٰهَ مُخْلِصًا لَهُ الدّٖينَۙ ﴿١١﴾

---

**az bir müddət içində Allah-Təalaya kafir olmağınla ləzzət al, həqiqətən, sən cəhənnəm odu əhlindənsən, axirətdə mütləq, cəhənnəmə daxil olacaqsan.**

**9) (اَمَّنْ هُوَ قَانِتٌ اٰنَآءَ الَّيْلِ سَاجِدًا وَقَٓائِمًا يَحْذَرُ الْاٰخِرَةَ وَيَرْجُوا رَحْمَةَ رَبِّهٖ)** - (Ey Məhəmməd), **o şəxs ki, gecənin saatlarını səcdədə və "qiyam"da** (namazda ayaq üstə olma) **olduğu halda Allah-Təalanın itaətində olub, axirət əzabından qorxub, rəbbi Allah-Təalanın rəhmətinə ümid edir, belə şəxs o şəxs kimidir ki, bu sifətlərin ziddi onda olub Allah-Təalaya asi olsun? Əlbəttə, onun kimi olmayıb mömin və müvəhhid ilə asi eyni olmaz.**

**(قُلْ هَلْ يَسْتَوِي الَّذٖينَ يَعْلَمُونَ وَالَّذٖينَ لَا يَعْلَمُونَ)** - (Ey Məhəmməd), **müşriklərə de ki, bəs alim ilə cahil bərabər olarmı? Necə ki, alim cahillə bərabər olmaz, habelə müti ilə asi də bərabər olmaz. (اِنَّمَا يَتَذَكَّرُ اُو۬لُوا الْاَلْبَابِ) - Həqiqətən, Allah-Təalanın nəsihətlərini ağıl sahibləri yad edib, qəbul edərlər. Amma qəbul etməyənlər, cahillər və səfehlər qatarına mənsub olarlar.**

**10) (قُلْ يَا عِبَادِ الَّذٖينَ اٰمَنُوا اتَّقُوا رَبَّكُمْ)** - (Ey Məhəmməd), **xalqa de ki, Allah-Təala buyurur: "Ey iman edən bəndələrim, rəbbiniz Allah-Təaladan qorxub, itaət edib, ona asi olmaqdan çəkinin. (لِلَّذٖينَ اَحْسَنُوا فٖي هٰذِهِ الدُّنْيَا حَسَنَةٌ) - O şəxslər ki, bu dünyada onlardan xeyir əməl meydana gələ, onlardan ötrü o əməllərinin müqabilində Allah-Təalanın yanında vəsfi mümkün olmayan mükafat vardır. (وَاَرْضُ اللّٰهِ وَاسِعَةٌ) - Əgər desəniz ki, biz olduğumuz şəhərdə və ya kənddə xeyir əməl etməyə qadir deyilik, bizə mane olurlar, bu sözünüzün cavabı budur ki, həqiqətən, Allah-Təalanın yer üzü genişdir. Gedin o yerlərə ki, orada dininizi gözəl vəchlə qoruyub, hər bir xeyir əməl etməyə qadir olasınız, necə ki, peyğəmbərlər təbliğ imkanı olmayan yerlərdən çıxıb, başqa yerlərə getdilər, bu üzr sizdən ötrü qəbul olunan deyildir. (اِنَّمَا يُوَفَّى الصَّابِرُونَ اَجْرَهُمْ بِغَيْرِ حِسَابٍ) - Həqiqətən, o şəxslər ki, hər bir bəla və müsibətə səbir edir, o cümlədən vətənlərindən aralı düşüb, dinlərini qorumaqdan ötrü başqa yerlərə gedib, müsibətlərə düçar olurlar, Allah-Təala saysız-hesabsız əcr və savabı onlara bəxş edər.**

**11-12) (قُلْ اِنّٖٓي اُمِرْتُ اَنْ اَعْبُدَ اللّٰهَ مُخْلِصًا لَهُ الدّٖينَ)** - (Ey Məhəmməd), **de ki, mən həqiqətən, Allah-Təala tərəfindən əmr olunmuşam ki, dinimi Allah-Təalaya məxsus etdiyim halda ona ibadət edim.**

وَاُمِرْتُ لِاَنْ اَكُونَ اَوَّلَ الْمُسْلِمِينَ ﴿١٢﴾ قُلْ اِنّ۪ٓي اَخَافُ اِنْ عَصَيْتُ رَبّ۪ي عَذَابَ يَوْمٍ عَظ۪يمٍ﴿١٣﴾
قُلِ اللّٰهَ اَعْبُدُ مُخْلِصًا لَهُ د۪ين۪يۙ ﴿١٤﴾ فَاعْبُدُوا مَا شِئْتُمْ مِنْ دُونِه۪ۜ قُلْ اِنَّ الْخَاسِر۪ينَ الَّذ۪ينَ خَسِرُٓوا
اَنْفُسَهُمْ وَاَهْل۪يهِمْ يَوْمَ الْقِيٰمَةِۜ اَلَا ذٰلِكَ هُوَ الْخُسْرَانُ الْمُب۪ينُ ﴿١٥﴾ لَهُمْ مِنْ فَوْقِهِمْ ظُلَلٌ مِنَ النَّارِ
وَمِنْ تَحْتِهِمْ ظُلَلٌۜ

---

(وَاُمِرْتُ لِاَنْ اَكُونَ اَوَّلَ الْمُسْلِمِينَ) - **Dinimi Allah-Təalaya məxsus etdiyim halda əmr olunmuşam ki,** (ağıl mənə əmr edir ki,) **Allah-Təalaya itaət edənlərin ilki, gərək, mən olam. Belə olan halda siz müşriklərin rəyinə necə tabe olum?**

**13)** (قُلْ اِنّ۪ٓي اَخَافُ اِنْ عَصَيْتُ رَبّ۪ي عَذَابَ يَوْمٍ عَظ۪يمٍ) - (Müşriklər Allah Rəsulunu ata-baba dinini təqlid edib, islam dinini tərk etməyə dəvət edirdilər. Onların ümidini kəsməkdən ötrü bu ayələr nazil oldu, buyurur:) **müşriklərə de ki,** (ey Məhəmməd), **əgər mən rəbbim Allah-Təalaya asi olub, islam dinini tərk edib, ata-baba dininə təqlid edib onlara tabe olsam, böyük bir günün** (qiyamət gününün) **əzabından qorxaram ki, həmin gün Allah-Təala mənə əzab etsin.** (Müşriklər cəhalət və nadanlıqdan Qurani-Şərifin açıq-aydın ayələrini qəbul etməyib, inkar etdikləri üçün peyğəmbər Allah-Təalanın təlqini ilə bu kəlamları onlara bildirir, yəni, əgər mən sizin ata-baba dininizə daxil olmağı xahiş etsəm də, mümkün olmayacaqdır. Çünki Allah-Təala mənə əmr edibdir ki, gərək islam dinində olub, sizin dininizə meyl etməyim, əslində mən Allah-Təalanın əzabından qorxuram. Sizin dini qəbul edə bilmərəm, məndən əl çəkin, siz gəlin, mənim dinimi seçin).

**14-15)** (قُلِ اللّٰهَ اَعْبُدُ مُخْلِصًا لَهُ د۪ين۪يۙ) - (Ey Məhəmməd), **müşriklərə de ki, heç vaxt mən sizin dininizi seçmərəm. Əksinə, dinimi Allah-Təalaya məxsus etdiyim halda, ancaq ona ibadət edirəm. (Fəabudu ma şitum min dunihi) İndi ki, siz mənim sözümə itaət etmədiniz, gedin Allah-Təaladan başqa nəyə istəyirsiniz, ibadət edin, mən sizə mane olan deyiləm, Allah-Təala özü sizdən intiqam alacaqdır.**

(فَاعْبُدُوا مَا شِئْتُمْ مِنْ دُونِه۪ۜ قُلْ اِنَّ الْخَاسِر۪ينَ الَّذ۪ينَ خَسِرُٓوا اَنْفُسَهُمْ وَاَهْل۪يهِمْ يَوْمَ الْقِيٰمَةِۜ) - (Ey Məhəmməd), **müşriklərə de ki, ziyankarlıqda usta olub, hər bir xəbisliyə sahib olan o şəxslərdir ki, qiyamət günündə həm öz nəfslərinə, həm də ailələrinə zərər verib cəhənnəmə daxil olarlar. Çünki dünyada onlar zəlalətdə olub, ailələrini də zəlalətə salıblar.** (اَلَا ذٰلِكَ هُوَ الْخُسْرَانُ الْمُب۪ينُ) - (Ey Məhəmməd), **xəbərdar ol ki, zahir və aşkar olan ziyan budur ki, sənə bəyan etdim.**

**16)** (لَهُمْ مِنْ فَوْقِهِمْ ظُلَلٌ مِنَ النَّارِ وَمِنْ تَحْتِهِمْ ظُلَلٌۜ) - (Ey Məhəmməd), **bu yad olunan ziyankarlardan ötrü cəhənnəmin yuxarı və aşağı tərəflərində**

ذٰلِكَ يُخَوِّفُ اللّٰهُ بِهٖ عِبَادَهُ ۜ يَا عِبَادِ فَاتَّقُونِ ﴿١٦﴾ وَالَّذٖينَ اجْتَنَبُوا الطَّاغُوتَ اَنْ يَعْبُدُوهَا وَاَنَابُوٓا اِلَى اللّٰهِ لَهُمُ الْبُشْرٰى ۚ فَبَشِّرْ عِبَادِ ﴿١٧﴾ اَلَّذٖينَ يَسْتَمِعُونَ الْقَوْلَ فَيَتَّبِعُونَ اَحْسَنَهُ ۜ

---

**od təbəqələrindən kölgələr vardır. Kölgədə insan rahat olar, lakin o kölgədə əzab onları tutub, hər bir tərəfdən od onları əhatə edəcəkdir.** (ذٰلِكَ يُخَوِّفُ اللّٰهُ بِهٖ عِبَادَهُ ۜ يَا عِبَادِ فَاتَّقُونِ ۜ) - (Ey Məhəmməd), **bu əzablar ki bəhs olundu, Allah-Təala bu əzablarla öz bəndələrini qorxudur* ki, onları əzaba vaqe edən əməllərdən çəkinsinlər. Ey mənim bəndələrim, məndən qorxub, mənim əzabıma bais olan əməlləri tərk edin.**

*(*Qeyd: "Allah-Təala nə gözəl nəsihət edir, həqiqətən mənim qəsdim sizə əzab etmək deyildir. Bəlkə bu əzablarla sizi qorxuduram ki, vəhşəti, zəlaləti, cəhaləti tərk edib insanlıq aləminə daxil olasınız, Allah-Təala gah öyüd-nəsihətlə, gah xəbərdarlıq və qorxutmaqla, gah da qissə və hekayə nəql etməklə bizi hidayətə dəvət edir. Qurani-Şərifin nəsihətini qəbul etməyən şəxslər bəs hansı nəsihəti qəbul edəcəklər? İlahi, biz islam ümməti, sən göndərən açıq kitabı bir kənara qoyub, gah mübarək Ramazan ayında, ya xəstə can çəkişərkən, ölü üstündə, ya da ki, bəzi ölkələrdə (bizim ölkədəki kimi) cənazəni dəfnə götürərkən, küçələrdə çirkin avazla oxumağa məxsus etmişik. Quranın din və dünya işlərini ehtiva edən uca məzmunundan və faydasından bizim xəbərimiz yoxdur. Ruhani rəislərimiz ancaq avazla Quran oxumağı bizə təlim ediblər və deyiblər: "Siz Quranın mənasını bilməyə qadir deyilsiniz, biz özümüz də Quranı bilmirik, Quran elminə ancaq bəzi səhabələr və imamlar agahdır. Sizə namaz, oruc ehkamını bilməkdən başqa bir şey lazım deyildir. Bunlara da agah olmaq üçün Qurana ehtiyac yoxdur. Gərək təqlid edib bir müftinin əsərini özünüzə imam və rəhbər təyin edəsiniz. Hər nə ki, sizdən ötrü o əsərdə qeyd olunubdur, gərək onları dəlil istəmədən qəbul edəsiniz. Əgər dəlil istəsəniz, o vaxt təqlidiniz batil olar, təqlid ki, batil oldu, əməl də batildir. Alimlərin bir qismi deyirlər: təqlid edəndə də gərək diri müctəhidi təqlid edəsiniz. Ölmüş müctəhidi təqlid etmək caiz olmayıb, bir saat da təqlidsiz qalmaq caiz deyildir. İlahi, bizim rəislərimiz bizə belə təlqin ediblər, bizi Qurani-Şərifdən hürküdüb, kənar salıblar. Bəs biz Qurani-Şərifin uca məzmununu necə dərk edək? İlahi, "onlara ikiqat əzab ver!" Bu rəislərin rəzilliyi, əxlaqsızlığı düzəlməsə, bizim halımız elə belə də qalıb, bizim cavabımızda buyuracaqsan: "hər kəs üçün ikiqat əzab vardır!" Nə ki, zəif cəhətlərimiz var, mən həqir müəllif kitabda göstərirəm. İlahi, bizim işimiz bitib, bundan sonra gələn rəislərə bəsirət bəxş elə, bəlkə gözəli, çirkini, məntiqli olanı dərk etsinlər. "Allah istəyən hər kəsə lütfünü bəxş edər, amin!"*

**17-18)** (وَالَّذٖينَ اجْتَنَبُوا الطَّاغُوتَ اَنْ يَعْبُدُوهَا وَاَنَابُوٓا اِلَى اللّٰهِ لَهُمُ الْبُشْرٰى ۚ) - **O şəxslər ki, şeytana** (şəri əmr edən xəbis nəfsə) **ibadət etməkdən çəkinib, Allah-Təala tərəfinə dönüb, Ona ibadət edirlər, onlardan ötrü axirətdə əcr və savab müjdəsi vardır.** (فَبَشِّرْ عِبَادِ ۙ اَلَّذٖينَ يَسْتَمِعُونَ الْقَوْلَ فَيَتَّبِعُونَ اَحْسَنَهُ) - (Ey

أُولٰٓئِكَ الَّذِينَ هَدٰيهُمُ اللّٰهُ وَاُولٰٓئِكَ هُمْ اُولُوا الْاَلْبَابِ ﴿١٨﴾ اَفَمَنْ حَقَّ عَلَيْهِ كَلِمَةُ الْعَذَابِ اَفَاَنْتَ تُنْقِذُ
مَنْ فِي النَّارِ ﴿١٩﴾ لٰكِنِ الَّذِينَ اتَّقَوْا رَبَّهُمْ لَهُمْ غُرَفٌ مِنْ فَوْقِهَا غُرَفٌ مَبْنِيَّةٌ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ

---

Məhəmməd), **o bəndələrim ki, mənim tərəfimdən gələn ehkamdan iki söz eşidələr,* biri gözəl, digəri daha gözəl, daha gözəlinə tabe olub onu qəbul edərlər. Onlara mənim tərəfimdən əcr və savab müjdəsi ver.** (أُولٰٓئِكَ الَّذِينَ هَدٰيهُمُ اللّٰهُ وَاُولٰٓئِكَ هُمْ اُولُوا الْاَلْبَابِ) **- Bu yad olunan şəxslər (hər bir hökmün ən gözəlinə tabe olanlar) o şəxslərdir ki, Allah-Təala onları tövhid və ibadətə hidayət edibdir, onlar elə ağıl sahibidir ki, ağılları ilə pisi, yaxşını dərk edib, haqqa tabe olublar.**

*(*Qeyd: “Məsələn, Qurani-Şərifdə Allah-Təala ümmətin övladları üçün ehsan və sədəqə verməyi əmr edibdir, hər bir şeydən sədəqə vermək, hətta yoxsula bir parça çörək də vermək gözəl bir işdir. Lakin digər bir ayədə də buyurub: “Mənim yolumda ümmətin övladlarını sevib, məhəbbətiniz olan şeydən (sarıdan, ağdan: “Qızıl-gümüşdən) din yolunda xərcləyin. Buna əməl edib, millətin ehtiyacını dəf etmək üçün (sarıdan. ağdan) keçmək daha gözəldir. Ehkam da bunu deyir. Zülmün müqabilində o ölçüdə qisas almaq gözəldir, lakin əfv etmək daha gözəldir, ayə bu mətləbə işarə edir. Heyf ki, bizdə şüur və idrak gücü yoxdur. Əgər şüurumuz olsaydı, bizim varlılarımızın əksəriyyəti üst-üstə var-dövlət yığıb, onu qorumaqda min cür bəlaya düçar olub, ümmətin övladlarından onu əsirgəməzdilər. Əksinə, comərdliklə kisələrini açıb, digər millətlərin varlıları kimi millətin ehtiyacı üçün sərf edib, dünya və axirət səadətinə nail olardılar, daha varislərdən ötrü qoyub getməzdilər ki, onlardan sonra şərab və qumara sərf edib, o əməllərlə onun ruhunu da bu zülmə şərik etsinlər. Həqiqətən, bizim əksər varlılarımızın işi təəccüblüdür. Nə öz dinlərində varid olan ayə və hədislərə baxırlar və nə də insaf və mürüvvətə tabe olurlar, nə də özgə millətlərdən ibrət alırlar. Lakin bəzi varlılardan xeyir əməllər meydana gəldiyi üçün ümidvar oluruq ki, bundan sonra xeyir əməllər edib, özlərindən sonra tarixdə gözəl ad qoyub gedəcəklər. Allah şəfqət və mərhəmət yoluna götürəndir!)*

**19)** (اَفَمَنْ حَقَّ عَلَيْهِ كَلِمَةُ الْعَذَابِ) **-** (Ey Məhəmməd), **bizim tərəfimizdən kimə əzab kəliməsi layiq olub, hökm olunsa ki gərək əzab içində olsun, belə bir şəxsi sən əzabdan xilas edə bilərsənmi?** (اَفَاَنْتَ تُنْقِذُ مَنْ فِي النَّارِ) **- Ya da ki sən** (ey Məhəmməd), **cəhənnəm odunda əzab çəkən şəxsi oradan çıxara bilərsənmi? Yox, sənin bunların heç birinə qüdrətin yoxdur. Allah-Təala istəsə özü xilas edər. Lakin əzaba layiq olanlar cəhənnəmdə olacaqlar.**

**20)** (لٰكِنِ الَّذِينَ اتَّقَوْا رَبَّهُمْ) **- Lakin o şəxslər ki rəbləri Allah-Təaladan qorxub, xeyir əməl edirlər,** (لَهُمْ غُرَفٌ مِنْ فَوْقِهَا غُرَفٌ مَبْنِيَّةٌ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ) **onlardan ötrü behiştdə bir-birinin üstündə mərtəbələri olan köşklər və uca**

وَعْدَ اللّٰهِ ۜ لَا يُخْلِفُ اللّٰهُ الْمِيعَادَ ﴿٢٠﴾ اَلَمْ تَرَ اَنَّ اللّٰهَ اَنْزَلَ مِنَ السَّمَٓاءِ مَٓاءً فَسَلَكَهُ يَنَابِيعَ فِي الْاَرْضِ
ثُمَّ يُخْرِجُ بِهٖ زَرْعًا مُخْتَلِفًا اَلْوَانُهُ ثُمَّ يَهِيجُ فَتَرٰيهُ مُصْفَرًّا ثُمَّ يَجْعَلُهُ حُطَامًا ۜ اِنَّ فِي ذٰلِكَ لَذِكْرٰى لِاُو۬لِي
الْاَلْبَابِ ۟ ﴿٢١﴾ اَفَمَنْ شَرَحَ اللّٰهُ صَدْرَهُ لِلْاِسْلَامِ فَهُوَ عَلٰى نُورٍ مِنْ رَبِّهٖ ۜ فَوَيْلٌ لِلْقَاسِيَةِ قُلُوبُهُمْ مِنْ
ذِكْرِ اللّٰهِ ۜ اُو۬لٰٓئِكَ فِي ضَلَالٍ مُبِينٍ ﴿٢٢﴾ اَللّٰهُ نَزَّلَ اَحْسَنَ الْحَدِيثِ كِتَابًا مُتَشَابِهًا مَثَانِيَ ۗ

---

**qəsrlər vardır ki, onların altından çaylar axar. (وَعْدَ اللّٰهِ ۜ لَا يُخْلِفُ اللّٰهُ الْمِيعَادَ) - Allah-Təala bu mənzilləri möminlərə vəd edir və vədi haqdır, Allah-Təala vədinə xilaf çıxmaz.**

**21)(اَلَمْ تَرَ اَنَّ اللّٰهَ اَنْزَلَ مِنَ السَّمَٓاءِ مَٓاءً فَسَلَكَهُ يَنَابِيعَ فِي الْاَرْضِ) -** (Ey Məhəmməd), **baxıb görmürsən ki, həqiqətən də, Allah-Təala göydən su göndərib, o suyu** (bədəndə olan damarlar kimi) **yerə daxil edib, çeşmələr təyin edib. (ثُمَّ يُخْرِجُ بِهٖ زَرْعًا مُخْتَلِفًا اَلْوَانُهُ ) - Ondan sonra o suyun səbəbi ilə rəngləri müxtəlif** (yaşıl, qırmızı, ağ, sarı, qara) **olan əkin-biçin məhsulları çıxardar.**

**(ثُمَّ يَهِيجُ فَتَرٰيهُ مُصْفَرًّا) - Ondan sonra o yerdəki əkinləri quruyub, saralmış görərsən. (ثُمَّ يَجْعَلُهُ حُطَامًا) - Ondan sonra Allah-Təala o gözəl, xoş surətdə olan əkini əzilmiş və dağılmış hala salıb məhv edər.**

**(اِنَّ فِي ذٰلِكَ لَذِكْرٰى لِاُو۬لِي الْاَلْبَابِ ۟ ) -** (Ey Məhəmməd), **həqiqətən, bu əkinin əvvəlində və sonunda ağıl sahiblərindən ötrü agah olub ibrət alacaqları şeylər vardır. Gərək agah olub, əkinin xüsusiyyətlərindən bir yaradıcının, əbədi və əzəli qüdrət sahibinin varlığına inanıb tabe olsunlar.**

**22) (اَفَمَنْ شَرَحَ اللّٰهُ صَدْرَهُ لِلْاِسْلَامِ فَهُوَ عَلٰى نُورٍ مِنْ رَبِّهٖ ۜ) -** (Ey Məhəmməd), **bir şəxs ki, Allah-Təala onun sinəsini islamdan ötrü açıb, genişlik verib, islamın nuru səbəbi ilə elm və hikmət onun qəlbinə daxil olub, öz rəbbi Allah-Təala tərəfindən nur və hidayətdə olsun,** (həqiqi insanlıq sifətinə sahib olsun), **bəs bu şəxs o şəxs kimidir ki, bu sifətlərin ziddi onda olub, qəlbi dar və qatı, zülmət və cəhalətlə dolu olsun? Bəs bunlar bərabər olarmı?**

**(فَوَيْلٌ لِلْقَاسِيَةِ قُلُوبُهُمْ مِنْ ذِكْرِ اللّٰهِ) - Əzab olsun o şəxslərə ki, onların qəlbləri Allah-Təalanın zikrini eşitdikləri halda qatılıqları artar və halbuki gərək mülayimlikləri və mərhəmətləri artaydı.** (İlahi ayələri təkzib etmək qəlbin qatılaşmasına və paslanmasına səbəb olar). **(اُو۬لٰٓئِكَ فِي ضَلَالٍ مُبِينٍ ) -** (Ey Məhəmməd), **bu yad olunan şəxslər açıq-aşkar zəlalətdədirlər.**

**23) (اَللّٰهُ نَزَّلَ اَحْسَنَ الْحَدِيثِ كِتَابًا مُتَشَابِهًا مَثَانِيَ) - Allah-Təala siz insan nəslindən ötrü sözlərin ən gözəli olan bir kitab** (Quran) **göndərdi. Fəsahət və bəlağətdə, gözəllik və nəzmdə, hikmət və nəsihəti ehtiva etməkdə bütün sözlərin ən gözəlidir. Quran ayələrinin hamısı haqq və doğru olub, dünya və axirət faydasını göstərməkdə bir-birinə oxşar və bərabərdirlər.**

تَقْشَعِرُّ مِنْهُ جُلُودُ الَّذِينَ يَخْشَوْنَ رَبَّهُمْ ۚ ثُمَّ تَلِينُ جُلُودُهُمْ وَقُلُوبُهُمْ اِلٰى ذِكْرِ اللّٰهِ ۗ ذٰلِكَ هُدَى اللّٰهِ يَهْدِي
بِهٖ مَنْ يَشَٓاءُ ۗ وَمَنْ يُضْلِلِ اللّٰهُ فَمَا لَهُ مِنْ هَادٍ ﴿٢٣﴾ اَفَمَنْ يَتَّقِي بِوَجْهِهٖ سُٓوءَ الْعَذَابِ يَوْمَ الْقِيٰمَةِ ۜ وَقِيلَ
لِلظَّالِمِينَ ذُوقُوا مَا كُنْتُمْ تَكْسِبُونَ﴿٢٤﴾ كَذَّبَ الَّذِينَ مِنْ قَبْلِهِمْ فَاَتٰيهُمُ الْعَذَابُ مِنْ حَيْثُ لَا يَشْعُرُونَ
﴿٢٥﴾ فَاَذَاقَهُمُ اللّٰهُ الْخِزْيَ فِي الْحَيٰوةِ الدُّنْيَا ۚ وَلَعَذَابُ الْاٰخِرَةِ اَكْبَرُ لَوْ كَانُوا يَعْلَمُونَ﴿٢٦﴾

---

(Quranda bəhs olunan qissələrin zehinləri cəlb edib, fayda verməsi üçün o qissələr təkrar-təkrar yad olunubdur). (تَقْشَعِرُّ مِنْهُ جُلُودُ الَّذِينَ يَخْشَوْنَ رَبَّهُمْ) **- Qurani-Şərifdə vəd edilən əzabları eşitməkdən Allah-Təaladan qorxan şəxslərin cildləri qırışar, saçaqlanmış tükləri bədənlərində nizə kimi durar.** (ثُمَّ تَلِينُ جُلُودُهُمْ وَقُلُوبُهُمْ اِلٰى ذِكْرِ اللّٰهِ) **- Ondan sonra elə ki Allah-Təalanın comərdlik və səxavətini, rəhmət və rəftarını yad etdilər, o qorxu və dəhşət onlardan gedib, qırışıqları açılar, qəlblərindəki qorxu ümid və etimadla əvəz olunar.** (ذٰلِكَ هُدَى اللّٰهِ يَهْدِي بِهٖ مَنْ يَشَٓاءُ) **- Sözlərin ən gözəli** (Quran) **Allah-Təalanın hidayət səbəbidir. Allah-Təala kimi istəsə,** (o şəxs hidayətə qabil olsa), **bu Quran səbəbinə Allah-Təala o şəxsi haqq tərəfinə hidayət edər.** (وَمَنْ يُضْلِلِ اللّٰهُ فَمَا لَهُ مِنْ هَادٍ) **Və kim ki, hidayətə qabil olmayıb, Allah-Təala onu zəlalətdə saxlasa,** (Ey Məhəmməd), **ondan ötrü hidayət edən tapılmaz ki, onu zəlalətdən çıxartsın.**

**24)** (اَفَمَنْ يَتَّقِي بِوَجْهِهٖ سُٓوءَ الْعَذَابِ يَوْمَ الْقِيٰمَةِ) **-** (Ey Məhəmməd), **bir şəxs ki, qiyamət günündə əzabın şiddətini üzü ilə dəf edir, bəs bu şəxs o şəxs kimidir ki, əzabdan amanda olsun? (Hər bir bəla insanın üzünə varid olanda onu əli ilə dəf edər. Fasiqləri, günahkarları qiyamət günündə qolları bağlı halda od içinə salanda, onlar üzləri ilə odu qarşılayacaqları üçün guya üzlərilə əzabı özlərindən dəf etmək istəyirlər, halbuki bu, mümkün olmayıb, bəlkə onlardan ötrü daha da şiddətli əzab olacaqdır.**

(وَقِيلَ لِلظَّالِمِينَ ذُوقُوا مَا كُنْتُمْ تَكْسِبُونَ) **- Elə ki, üzü üstə cəhənnəm oduna daxil oldular, Allah-Təala tərəfindən zalımlara deyilər: "İndi, dadın o əməllərin cəzasını ki, dünyada onları edirdiniz.**

**25)** (كَذَّبَ الَّذِينَ مِنْ قَبْلِهِمْ فَاَتٰيهُمُ الْعَذَابُ مِنْ حَيْثُ لَا يَشْعُرُونَ) - (Ey Məhəmməd), **səni təkzib edən müşriklərdən əvvəl yaşayan ümmətlər də onlara göndərilən peyğəmbərləri təkzib etdilər. O vaxt da onların qəlblərinə, xəyallarına gəlməyən tərəfdən onlara əzab gəldi. Hamısı həlak oldular.**

**26)** (فَاَذَاقَهُمُ اللّٰهُ الْخِزْيَ فِي الْحَيٰوةِ الدُّنْيَا) **- Allah-Təala onlara dünya həyatında zəlil və aciz olmağı dadızdırdı.** (وَلَعَذَابُ الْاٰخِرَةِ اَكْبَرُ لَوْ كَانُوا يَعْلَمُونَ) **Amma əgər agah olsalar, axirət əzabı dünya əzabından daha şiddətli, zəlil, rəzil etməkdə daha artıqdır.**

وَلَقَدْ ضَرَبْنَا لِلنَّاسِ فِي هٰذَا الْقُرْاٰنِ مِنْ كُلِّ مَثَلٍ لَعَلَّهُمْ يَتَذَكَّرُونَۚ ﴿٢٧﴾ قُرْاٰنًا عَرَبِيًّا غَيْرَ ذِي عِوَجٍ لَعَلَّهُمْ يَتَّقُونَ ﴿٢٨﴾ ضَرَبَ اللّٰهُ مَثَلًا رَجُلًا فِيهِ شُرَكَٓاءُ مُتَشَاكِسُونَ وَرَجُلًا سَلَمًا لِرَجُلٍۜ هَلْ يَسْتَوِيَانِ مَثَلًاۜ اَلْحَمْدُ لِلّٰهِۚ بَلْ اَكْثَرُهُمْ لَا يَعْلَمُونَ ﴿٢٩﴾

---

**27)** (وَلَقَدْ ضَرَبْنَا لِلنَّاسِ فِي هٰذَا الْقُرْاٰنِ مِنْ كُلِّ مَثَلٍ لَعَلَّهُمْ يَتَذَكَّرُونَ) - (Ey Məhəmməd), **həqiqətən, bu Qurani-Kərimdə insanlardan ötrü hər bir məsəl və qissələrdən bəhs etdik ki, onlar agah olub, nəsihəti qəbul edib, nicat tapsınlar. Amma Qurani-Şərifin gözəl nəsihətlərindən heç faydalanmayıb, cəhalət və nadanlıq qaranlığında qalanlar bizim sonsuz əzabımıza düçar olacaqlar.**

**28)** (قُرْاٰنًا عَرَبِيًّا غَيْرَ ذِي عِوَجٍ لَعَلَّهُمْ يَتَّقُونَ) - (Ey Məhəmməd), **bu Quran ərəb dilindədir, hansı ki, Məkkə əhlinin və ərəblərin öz dilidir. Heç bir ziddiyyət və əyrilik onda olmayan halda onu sənə göndərdik. Ta ki, küfr və şirkdən kənar olub bizim tövhid və qüdrətimizə tabe olsunlar. Bununla birlikdə yenə Quranı təkzib edib şirklərində qalırlar.**

**29)** (ضَرَبَ اللّٰهُ مَثَلًا رَجُلًا فِيهِ شُرَكَٓاءُ مُتَشَاكِسُونَ) - (Ey Məhəmməd), **müşriklərə de ki, Allah-Təala sizdən ötrü məsəl qeyd edir. Bir qulam ki, onda neçə nəfər şərik olub, bir-birləri ilə o qulam üstündə dalaşıb, hər biri o qulamı bir tərəfə çəkib deyə ki, bu, mənim qulamımdır, mən ona əmr etməyə layiqəm. O qulam da öz işində çaşqın qalıb bilməyə ki, ağalarından hansı birinə xidmət etsin ki, ondan razı qalsın və bir ehtiyacı olanda hansına müraciət etsin. Belə bir qulamı Allah-Təala sizdən ötrü məsəl kimi yad edir.**

(وَرَجُلًا سَلَمًا لِرَجُلٍۜ) - **Bir də o qulamı məsəl verir ki, ancaq bir kişiyə qulam olub, başqa heç bir ağası olmasın. Bir şəxsə xidmət edib, hər bir ehtiyacını ondan istəyib, özü xatircəm olsun, qəlbi aram olsun. Bəs bu iki qulamın hansının əhvalı yaxşı olar?** (هَلْ يَسْتَوِيَانِ مَثَلًاۜ) - **Bəs bu iki qulamın halları və vəziyyətləri bərabər olarmı?** (Habelədir müşriklə müvəhhidin halı, müşrik öz etiqadına görə gərək məbudların hamısını özündən razı və xoşnud etsin, amma bilməyəcəkdir ki, onlara necə xidmət və ibadət etsin ki, hamısı ondan razı olsun və ehtiyac vaxtında hansına müraciət etsin? Amma müvəhhid şəxs yeganə Allah-Təalaya xidmət, ibadət edib, hər bir ehtiyacını ondan istəyib, xatircəm və qayğısızdır). **(اَلْحَمْدُ لِلّٰهِۚ بَلْ اَكْثَرُهُمْ لَا يَعْلَمُونَ)** - (Ey Məhəmməd), **elə ki, bizim tövhidimiz sabit oldu, gərək həmd edib deyəsiniz: "Həmd-səna o Allah-Təalaya layiqdir ki, vahid və şəriksizdir. Bəlkə müşriklərin əksəriyyəti buna agah olmayıb, bizə şərik qoşurlar.** (Məkkə əhli olan müşriklər Allahın Rəsulunun ölməsini gözləyirdilər ki, onun ölməyinə sevinsinlər. Allah-Təala növbəti ayədə xəbər verir ki, ölüm hamıya

اِنَّكَ مَيِّتٌ وَاِنَّهُمْ مَيِّتُونَۘ ﴿٣٠﴾ ثُمَّ اِنَّكُمْ يَوْمَ الْقِيٰمَةِ عِنْدَ رَبِّكُمْ تَخْتَصِمُونَ۟ ﴿٣١﴾ فَمَنْ اَظْلَمُ مِمَّنْ كَذَبَ عَلَى اللّٰهِ وَكَذَّبَ بِالصِّدْقِ اِذْ جَٓاءَهُۜ اَلَيْسَ فِي جَهَنَّمَ مَثْوًى لِلْكَافِرِينَ ﴿٣٢﴾ وَالَّذٖي جَٓاءَ بِالصِّدْقِ وَصَدَّقَ بِهٖٓ اُو۬لٰٓئِكَ هُمُ الْمُتَّقُونَ ﴿٣٣﴾ لَهُمْ مَا يَشَٓاؤُ۫نَ عِنْدَ رَبِّهِمْۜ ذٰلِكَ جَزٰٓؤُا الْمُحْسِنٖينَۚ ﴿٣٤﴾ لِيُكَفِّرَ اللّٰهُ عَنْهُمْ اَسْوَاَ الَّذٖي عَمِلُوا

---

aiddir. Külli ruhlar öz sahibinə qayıdacaqdır. Ölməyə sevinmək mənasız, batil bir əməldir. Ağıllı şəxslərdən belə əməl əmələ gəlməz.)

**30)** (اِنَّكَ مَيِّتٌ وَاِنَّهُمْ مَيِّتُونَ) - (Ey Məhəmməd), **həqiqətən, sən öləcəksən. Bu Qüreyş camaatı ki, sənin ölümünü gözləyirlər, onlar da öləcək. Sənin ölməyini gözləmələri onlara bir fayda verməz.**

**31)** (ثُمَّ اِنَّكُمْ يَوْمَ الْقِيٰمَةِ عِنْدَ رَبِّكُمْ تَخْتَصِمُونَ) - (Ey Məhəmməd), **elə ki ölüm sizə gəldi, ölümdən sonra qiyamət günündə hamınız Allah-Təalanın hüzurunda cəm olub, mübahisə çıxaracaqsınız, sən deyəcəksən ki, ilahi, mən peyğəmbərliyi təbliğ edib, bunları sənin tərəfinə dəvət etdim. Qəbul etməyib, məni təkzib etdilər.** (O vaxt da müşriklər faydası olmayan cavablar verəcək, lakin onlardan qəbul olunmayacaqdır. Ya da ki cavab verməyə qadir olmayacaqlar). **Bizim əzabımız onları əhatə edib, həmişə əzabda qalacaqlar. Belə bir günü gözləsinlər. Sənin ölməyini niyə gözləyirlər?**

**32)** (فَمَنْ اَظْلَمُ مِمَّنْ كَذَبَ عَلَى اللّٰهِ وَكَذَّبَ بِالصِّدْقِ اِذْ جَٓاءَهُ) - (Ey Məhəmməd), **bir şəxs ki, Allah-Təalaya yalan, iftira edib, ondan ötrü övlad və şərik qoşur və doğru (Quran) ona gəldiyi halda, onu da təkzib edir, belə bir şəxsdən daha çox zalım olan kimdir?** (اَلَيْسَ فِي جَهَنَّمَ مَثْوًى لِلْكَافِرِينَ) **- Bəs belə kafirlərdən ötrü cəhənnəmdə mənzil və məkan yoxdurmu? Əlbəttə, onların mənzil və məkanı cəhənnəmdir və orada əbədi olaraq qalacaqlar.**

**33)** (وَالَّذٖي جَٓاءَ بِالصِّدْقِ وَصَدَّقَ بِهٖٓ اُو۬لٰٓئِكَ هُمُ الْمُتَّقُونَ) **- (Ey Məhəmməd), o peyğəmbərlər ki, bizim tərəfimizdən doğru kitabla gəlib, özü və ona iman gətirənlər o kitabı təsdiq edib,** (necə ki sən də ey Məhəmməd, o peyğəmbərlərdən bir nəfərsən, bizim tərəfimizdən Quran gətirib, bu Quranı sən və sənə iman gətirənlər təsdiq edibsiniz), **Allah-Təalaya itaət edən mömin şəxslər bunlardır.**

**34)** (لَهُمْ مَا يَشَٓاؤُ۫نَ عِنْدَ رَبِّهِمْۜ ذٰلِكَ جَزٰٓؤُا الْمُحْسِنٖينَ) - (Ey Məhəmməd), **o möminlərin hər istədiyi şey öz rəbləri Allah-Təalanın yanında hazır və mövcuddur. Gözəl əməl sahiblərinin mükafatı budur ki, istədikləri hər bir şey Allah-Təalanın yanında onlardan ötrü hazır olsun.**

**35)** (لِيُكَفِّرَ اللّٰهُ عَنْهُمْ اَسْوَاَ الَّذٖي عَمِلُوا) **- Allah-Təala möminlərə belə mükafat verər ki, onların etdiyi çirkin əməlləri** (tövbə səbəbinə) **məhv edib, ba-**

وَيَجْزِيَهُمْ اَجْرَهُمْ بِاَحْسَنِ الَّذٖي كَانُوا يَعْمَلُونَ ﴿٣٥﴾ اَلَيْسَ اللّٰهُ بِكَافٍ عَبْدَهُ ۜ وَيُخَوِّفُونَكَ بِالَّذٖينَ
مِنْ دُونِهٖ ۜ وَمَنْ يُضْلِلِ اللّٰهُ فَمَا لَهُ مِنْ هَادٍ ۚ ﴿٣٦﴾ وَمَنْ يَهْدِ اللّٰهُ فَمَا لَهُ مِنْ مُضِلٍّ ۜ اَلَيْسَ اللّٰهُ بِعَزٖيزٍ ذِي
انْتِقَامٍ ﴿٣٧﴾ وَلَئِنْ سَاَلْتَهُمْ مَنْ خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ لَيَقُولُنَّ اللّٰهُ ۜ قُلْ اَفَرَاَيْتُمْ مَا تَدْعُونَ مِنْ
دُونِ اللّٰهِ اِنْ اَرَادَنِيَ اللّٰهُ بِضُرٍّ هَلْ هُنَّ كَاشِفَاتُ ضُرِّهٖٓ

---

**ğışlasın. (وَيَجْزِيَهُمْ اَجْرَهُمْ بِاَحْسَنِ الَّذٖي كَانُوا يَعْمَلُونَ) - Dünyada etdikləri xeyir əməllərin əcr, savabını ən gözəl şəkildə möminlərə bəxş etsin.**

**36) (اَلَيْسَ اللّٰهُ بِكَافٍ عَبْدَهُ)** - (Müşriklər Allahın Rəsulunu qorxudub deyirdilər: "Bizim bütlərdən qorx, sənə zərər yetirərlər.")

**O vaxt bu ayə göndərildi. Buyurur:** (Ey Məhəmməd), **bəs Allah-Təala təkcə özü öz bəndəsinin hər bir işinə kifayət edib, onu fəlakətdən qoruyub, nicat verən deyilmi? Əlbəttə, Allah-Təala kifayət edəndir, sən də (Ey Məhəmməd), Allah-Təalanın bir bəndəsisən. Sənin də hər bir əmrinə kifayət edər. (وَيُخَوِّفُونَكَ بِالَّذٖينَ مِنْ دُونِهٖ)** - (Ey Məhəmməd), **müşriklər səni Allah-Təaladan başqa bütlərlə qorxudub deyirlər: "Onlardan sənə zərər gələr. Onlar sənə necə zərər verə bilər? (وَمَنْ يُضْلِلِ اللّٰهُ فَمَا لَهُ مِنْ هَادٍ) - Hər bir şəxsi ki, Allah-Təala öz zəlalətində saxlaya, ondan ötrü heç bir hidayət edən olmaz ki, onu zəlalətdən çıxartsın. Necə ki müşriklər zəlalət içində qalıb, bütləri zərər verən zənn edirlər.**

**37) (وَمَنْ يَهْدِ اللّٰهُ فَمَا لَهُ مِنْ مُضِلٍّ) - Və Allah-Təala kimə hidayət etsə, onu hidayətdən çıxardıb, zəlalətə salan olmaz. Necə ki Allah-Təala sənə (ey Məhəmməd), hidayət edib, peyğəmbər seçibdir. Heç bir şəxs səni zəlalətə salmağa qadir deyildir. Müşriklər özləri və bütləri sənə zərər verə bilməzlər. (اَلَيْسَ اللّٰهُ بِعَزٖيزٍ ذِي انْتِقَامٍ)** - (Ey Məhəmməd), **bəs Allah-Təala məxluqata qalib olub, asilərdən intiqam alan deyilmi? Əlbəttə, qalib və intiqam alandır. Bu müşriklər ki, sənə əziyyət verirlər, biz onlardan intiqam alacağıq.**

**36) (وَلَئِنْ سَاَلْتَهُمْ مَنْ خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ لَيَقُولُنَّ اللّٰهُ)** - (Ey Məhəmməd), **əgər müşriklərdən soruşsan ki, bu göyləri və yeri kim yaradıbdır? Əlbəttə, deyəcəklər: "Yeganə olan Allah-Təala yaradıbdır.** (Necə ki, müşriklər həmin mətləbi qəbul edib, bütləri ancaq şəfaətdən ötrü Allah-Təalaya şərik sayırdılar). **Bəs bununla belə Allah-Təalaya necə şərik qoşurlar?**

**(قُلْ اَفَرَاَيْتُمْ مَا تَدْعُونَ مِنْ دُونِ اللّٰهِ اِنْ اَرَادَنِيَ اللّٰهُ بِضُرٍّ هَلْ هُنَّ كَاشِفَاتُ ضُرِّهٖٓ)** - (Ey Məhəmməd), **müşriklərə de: "Mənə xəbər verin görüm, bəs o şəriklər** (bütlər) **ki, Allah-Təaladan başqa onlara dua və ibadət edirsiniz və məni də onlarla qorxudursunuz, əgər yeganə olan Allah-Təala mənə bir zərər vermək istəsə, o bütlər Allah-Təalanın zərərini məndən dəf edə bilərlərmi?**

اَوْ اَرَادَنِي بِرَحْمَةٍ هَلْ هُنَّ مُمْسِكَاتُ رَحْمَتِهٖۜ قُلْ حَسْبِيَ اللّٰهُۜ عَلَيْهِ يَتَوَكَّلُ الْمُتَوَكِّلُونَ ﴿٣٨﴾ قُلْ يَا قَوْمِ اعْمَلُوا عَلٰى مَكَانَتِكُمْ اِنّ۪ي عَامِلٌۚ فَسَوْفَ تَعْلَمُونَۙ ﴿٣٩﴾ مَنْ يَأْت۪يهِ عَذَابٌ يُخْز۪يهِ وَيَحِلُّ عَلَيْهِ عَذَابٌ مُق۪يمٌ﴿٤٠﴾ اِنَّٓا اَنْزَلْنَا عَلَيْكَ الْكِتَابَ لِلنَّاسِ بِالْحَقِّۚ فَمَنِ اهْتَدٰى فَلِنَفْسِه۪ۚ وَمَنْ ضَلَّ فَاِنَّمَا يَضِلُّ عَلَيْهَاۚ وَمَٓا اَنْتَ عَلَيْهِمْ بِوَك۪يلٍ ﴿٤١﴾ اَللّٰهُ يَتَوَفَّى الْاَنْفُسَ ح۪ينَ مَوْتِهَا وَالَّت۪ي لَمْ تَمُتْ ف۪ي مَنَامِهَاۚ

---

**37) (اَوْ اَرَادَنِي بِرَحْمَةٍ هَلْ هُنَّ مُمْسِكَاتُ رَحْمَتِهٖۜ) - Ya da ki əgər Allah-Təala mənə bir nemət, xeyir-bərəkət yetirmək istəsə, o bütlər Allah-Təalanın nemətinin mənə çatmasına mane ola bilərlərmi?” (قُلْ حَسْبِيَ اللّٰهُۜ عَلَيْهِ يَتَوَكَّلُ الْمُتَوَكِّلُونَ) -** (Ey Məhəmməd), **müşriklərə de ki, sizin bütlər mənə xeyir və zərər yetirməyə qadir deyil. Hər bir işimdə mənə yalnız Allah-Təala kifayət edər, təvəkkülüm və etimadım Allah-Təalayadır. Təvəkkül edənlər yeganə olan Allah-Təalaya təvəkkül edirlər.**

**39-40) (قُلْ يَا قَوْمِ اعْمَلُوا عَلٰى مَكَانَتِكُمْ اِنّ۪ي عَامِلٌ) -** (Ey Məhəmməd), **müşriklərə de ki, ey mənim xalqım, bu şirk halətindəsiniz və mənimlə ədavət edirsiniz, nə ki, məkr, hiylə əməli istəyirsiniz, mənim haqqımda edin, mən sizdən qorxmayıb, Allah-Təalanın əmr etdiyi hökmlərə əməl edəcəyəm.**

**(فَسَوْفَ تَعْلَمُونَۙ مَنْ يَأْت۪يهِ عَذَابٌ يُخْز۪يهِ وَيَحِلُّ عَلَيْهِ عَذَابٌ مُق۪يمٌ) - Əlbəttə agah olacaqsınız o şəxsə ki, dünyada ona əzab gəlib, onu zəlil etsin və axirətdə də ona həmişəlik əzab nazil olub, heç vaxt əzabdan xilas olmasın. O şəxs kimdir, mənəm, ya sizsiniz?** (Dünyada birinci Bədir savaşında müşriklərə varid olan əzabdan axirətdə əzab olunmağın doğruluğu zahir və aşkardır).

**41) (اِنَّٓا اَنْزَلْنَا عَلَيْكَ الْكِتَابَ لِلنَّاسِ بِالْحَقِّ) -** (Ey Məhəmməd), **həqiqətən, biz bu Quranı insan nəslinin xeyir və mənfəətindən ötrü sənə göndərdik, ta ki, onun ehkamına itaət edib, dünya və axirətdə nicat tapsınlar.**

**(فَمَنِ اهْتَدٰى فَلِنَفْسِه۪ۚ) - İndi kim ki Quranın ehkamına itaət edib, hidayət tapsa, o hidayətin faydası onun öz nəfsinə aid olar.**

**(وَمَنْ ضَلَّ فَاِنَّمَا يَضِلُّ عَلَيْهَاۚ وَمَٓا اَنْتَ عَلَيْهِمْ بِوَك۪يلٍ) -Və kim ki, zəlalət içində qalsa, o zəlalətin əzab və günahı onun öz nəfsinə aid olar. Heç bir şəxsə ondan bir zərər gəlməz.** (Ey Məhəmməd), **sən onlara vəkil deyilsən ki, onların əməlindən sorğu-sual olunasan. Daha sən onların zəlalətdə qalmağına görə həsrət çəkməyib, onların işlərini bizə həvalə et.**

**42) (اَللّٰهُ يَتَوَفَّى الْاَنْفُسَ ح۪ينَ مَوْتِهَا) -** (Ey Məhəmməd), **Allah-Təala öz kamil qüdrəti ilə cəmi nəfsləri ölüm vaxtında özü vəfat etdirib, ruhlarını alar. (وَالَّت۪ي لَمْ تَمُتْ ف۪ي مَنَامِهَا) - Və o nəfslər ki, yatıb, lakin yuxu halətində ölüm hələ onlara gəlməyibdir, onları da Allah-Təala vəfat etdirər.** (Yəni ruhlarının idarəsi Allah-Təalanın qüdrətinə tabedir, ölülər heç bir şeyi idarə edə

فَيُمْسِكُ الَّتِي قَضٰى عَلَيْهَا الْمَوْتَ وَيُرْسِلُ الْاُخْرٰىٓ اِلٰىٓ اَجَلٍ مُسَمًّىۜ اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ
يَتَفَكَّرُونَ ﴿٤٢﴾ اَمِ اتَّخَذُوا مِنْ دُونِ اللّٰهِ شُفَعَآءَۜ قُلْ اَوَلَوْ كَانُوا لَا يَمْلِكُونَ شَيْـًٔا وَلَا يَعْقِلُونَ﴿٤٣﴾
قُلْ لِلّٰهِ الشَّفَاعَةُ جَمِيعًاۜ لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ ثُمَّ اِلَيْهِ تُرْجَعُونَ﴿٤٤﴾

---

bilməzlər). (فَيُمْسِكُ الَّتِي قَضٰى عَلَيْهَا الْمَوْتَ) - (Ey Məhəmməd), **yatan nəfslərdən hansına ki, Allah-Təala ölməyi hökm edib, gərək, yuxu halətində ölüm ona gəlsin. Onu həmin halətdə saxlayar, daha ruh onun cəsədinə qayıtmayıb həmişəlik yuxuda qalar.** (وَيُرْسِلُ الْاُخْرٰىٓ اِلٰىٓ اَجَلٍ مُسَمًّىۜ) **- Amma yatan nəfslərdən hansının ki, ölməyinə hökm etməyibdir, ruhu onun bədəninə qaytarıb, dünyada ondan ötrü qərar verilən müəyyən vaxta kimi həyatını davam etdirər.** (اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَتَفَكَّرُونَ) **- Həqiqətən, nəfslərin ölmə vaxtında və yuxuda vəfat etməsində, yuxuda vəfat edənlərin həmin halətində, bəzilərinin ölüb, bəzilərinin yuxudan qalxıb, müəyyən vaxta kimi həyatlarını davam etdirməsində Allah-Təalanın tövhid və qüdrətini təfəkkür edənlərdən ötrü dəlil və sübutlar vardır.** (Əlbəttə, ağıl sahibləri belə işlərdə təfəkkür edib, Allah-Təalanın tövhid və qüdrətini dərk edirlər).

**43)** (اَمِ اتَّخَذُوا مِنْ دُونِ اللّٰهِ شُفَعَآءَ) - (Ey Məhəmməd), **bəlkə bu Qüreyş camaatı Allah-Təaladan başqa, bütləri özlərinə şəfaətçi qəbul ediblər?** (قُلْ اَوَلَوْ كَانُوا لَا يَمْلِكُونَ شَيْـًٔا وَلَا يَعْقِلُونَ) - (Ey Məhəmməd), **müşriklərə de ki, siz ki, bu bütlərə sitayiş edib onları şəfaətçi sayırsınız, hərçənd onlar heç bir şeyə malik olmayıb və heç bir şeyi dərk edib anlamırlar. Belə olan halda yenə onlara ibadət edirsiniz?**

**44)** (قُلْ لِلّٰهِ الشَّفَاعَةُ جَمِيعًاۜ) - (Ey Məhəmməd), **onlara* de ki, bütün şəfaətlər Allah-Təalaya məxsusdur. Heç bir nəfərin qiyamət günündə şəfaət etməyə qüdrəti yoxdur.** (Ancaq iki şərtlə: "Birinci şərt - gərək, şəfaət olunan şəxs şəfaətə qabil olsun. İkinci şərt - şəfaət edən şəxs, gərək, Allah-Təala tərəfindən xüsusi olaraq şəfaət etməyə məsul olsun. Bu iki şərtlə şəfaət olunar). **Amma siz müşriklərin nə bütləri şəfaət etməyə məsul olmayıb, nə də siz özünüz şəfaət olunmağa qabil deyilsiniz.** (لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ ثُمَّ اِلَيْهِ تُرْجَعُونَ) **- Göylərin və yerin hakimiyyəti Allah-Təalaya məxsusdur. Ölüm sizə gələndən sonra Allah-Təalanın tərəfinə qayıdacaqsınız. O vaxt da sizdən intiqam alacaqdır.**

*(*Qeyd: "İslam alimləri bu ayələrdən necə qafil olub, hər qrup şəfaət barəsində öz xəyalları ilə cürbəcür sözlər quraşdırıblar. İslam alimlərinin böyük bir qrupu şəfaət haqqında elə mübaliğə ediblər ki, hətta deyiblər: "Bir vaxt gələr ki, cəhənnəmdə heç kim qalmayıb, hamısı oradan çıxarlar". Əbədiyyət barəsində varid olan açıq-aydın ayələrə başqa məna yükləyiblər və bu barədə Abdullah ibn Ömər və İbn Asdan hədis nəql edirlər. Abdullah deyir: "Allahın Rəsulundan eşitdim, buyurdu: "Bir vaxt gələr ki, cəhənnəmin qapıları bir-*

*birinə dəyib, cəhənnəmdə qalan olmaz". Ağıl sahibləri diqqət etsinlər, bəs belə bir mənasız və hikmətsiz sözü Allahın Rəsulu kimi bir alicənaba isnad etmək layiqdirmi? O cənabdan belə bir məntiqsiz kəlam çıxarmı? Avam camaatı aldadan belə məntiqsiz kəlamı hansı səbəblə elə hədisçidən nəql edib, hədis kitablarında qeyd ediblər? Bunlar hamısı əbədiyyət barəsində varid olan açıq-aydın ayələrin hikmətini dərk etməyib, işin həqiqətinə agah olmamaqdan qaynaqlanır. Allah-Təala biz insan nəslinə Qurani-Şərifində gah huri və qəsrlər vəd edir, (necə ki, tamahkarların arzusudur) və gah da cəhənnəm atəşi və o əzabda əbədi qalmaq ilə qorxudur, (necə ki azğınların və zalımların halına münasibdir), insanlıq və gözəl əxlaq əldə etməyə sövq edir. Belə ki, nəfsinə müxalifət edib, zahirən və mənən kamilləşib, məlaikə adlanan ruhanilərin xüsusiyyətinə sahib olmaqla rəhmətə qovuşub, əzabdan nicat tapaq. Allahın ayələrindəki belə böyük faydaları uydurma hədis ilə inkar edib və islam ümmətini məğrurluğa, vəhşilik və cəhalətə vadar etmək nadanlıq və insafsızlıq əlamətidir. Bir digər qrup da şəfaətə inanıb, məzhəb rəislərinin özlərinə olan şəfaətinə etimad edib, onların məmnunluğunu əldə etməkdən ötrü o ilahi əmr və qadağaları tərk edib, Allah-Təalaya asi olmağı özlərinə asan bir yol seçiblər. Hətta ölülərini şəriətin göstərdiyi şəkildə dəfn etməyib, çürümüş sümüklərini də müqəddəs məkanlara nəql edib, o məkanlardan birdəfəlik cənnətə gedəcəklərinə mütləq etiqad və inam bəsləyirlər. Bəlkə də bu müqəddəs ərazinin eynən cənnətə nəql olunacağına etiqad edirlər. Bu barədə onlara irad tutanda ki, necə ola bilər ki, o ərazi eynən cənnətə nəql olunsun, halbuki onlarda pislik var, o vaxt da hədislər nəql edib deyərlər: "Bəli hədisdə varid olubdur ki, o müqəddəs yerləri cənnətə aparanda, cəhənnəmin üstündəki sirat körpüsündən keçəndə, o yerlər ələkdən keçirilib, tamamilə küfr və nəcisləri tökülüb, qalanları cənnətə daxil olarlar". Görəsən, bu kimi hədislərlə islam ümmətini bugünkü fəlakət gününə salıb, onları müşrik etmək bəs deyilmi? Qurani-Şərifin müqabilində uydurma hədislərə bağlanmaq islam dinini viran etdi. O hədisləri uyduranlara təəccüb edilməməlidir. Əksinə, onları cəm edib, kitab şəklinə salıb, avama verənlərə təəccüb edilməlidir. Xeyir, heç birindən təəccüb etmək lazım deyildir. Hakimiyyət təkəbbürü və yerlibazlıq əsli-nəcabəti olmayan avamları din və məzhəb əleyhinə vadar edən işlərdir. Necə ki, Mövlana Cəlaləddin Rumi deyir: (farsca ifadə). Bir tərəfdən Qurani-Şərif haqqında danışanda, Qurani-Şərifə zidd olan hədisləri tərk etmək lazımdır deyirlər. Digər tərəfdən hədislərdən danışanda, haqq gizlətmək, Qurana zidd deyilmi? Hədisləri dəftərlərinə qeyd edirlər. İslam ümmətinin bu günkü halı, fəlakət və rəzaləti və pərən-pərən olması Qurani-Şərifə müxalif olmaqdan meydana gəlibdir. Hidayətə və açıq həqiqətə götürən Allahdır).*

**45) (**وَاِذَا ذُكِرَ اللّٰهُ وَحْدَهُ اشْمَاَزَّتْ قُلُوبُ الَّذٖينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِۚ**) -** (Ey Məhəmməd), **o zaman ki sənin rəbbin Allah-Təala yalnız tək zikr olundu, axirətə iman etməyən müşriklərin qəlbləri sıxılıb, diksinərlər.**

وَاِذَا ذُكِرَ الَّذٖينَ مِنْ دُونِهٖٓ اِذَا هُمْ يَسْتَبْشِرُونَ ﴿٤٥﴾ قُلِ اللّٰهُمَّ فَاطِرَ السَّمٰوَاتِ وَالْاَرْضِ عَالِمَ
الْغَيْبِ وَالشَّهَادَةِ اَنْتَ تَحْكُمُ بَيْنَ عِبَادِكَ فٖيمَا كَانُوا فٖيهِ يَخْتَلِفُونَ ﴿٤٦﴾ وَلَوْ اَنَّ لِلَّذٖينَ ظَلَمُوا مَا
فِي الْاَرْضِ جَمٖيعًا وَمِثْلَهُ مَعَهُ لَافْتَدَوْا بِهٖ مِنْ سُٓوءِ الْعَذَابِ يَوْمَ الْقِيٰمَةِۜ وَبَدَا لَهُمْ مِنَ اللّٰهِ مَا لَمْ يَكُونُوا
يَحْتَسِبُونَ ﴿٤٧﴾ وَبَدَا لَهُمْ سَيِّـَٔاتُ مَا كَسَبُوا وَحَاقَ بِهِمْ مَا كَانُوا بِهٖ يَسْتَهْزِؤُنَ ﴿٤٨﴾ فَاِذَا مَسَّ
الْاِنْسَانَ ضُرٌّ دَعَانَاۘ ثُمَّ اِذَا خَوَّلْنَاهُ نِعْمَةً مِنَّاۙ قَالَ اِنَّمَٓا اُوتٖيتُهُ عَلٰى عِلْمٍۜ

---

(وَاِذَا ذُكِرَ الَّذٖينَ مِنْ دُونِهٖٓ اِذَا هُمْ يَسْتَبْشِرُونَ) - **Amma o zaman ki Allah-Təaladan başqa** (bütlərin) **adları yad olundu, qəflətən baxıb görərsən ki, müşriklər şadlıq edirlər.** (Allahın Rəsulunun (ə.s) qəlbi müşriklərin inadlarında israr etməsindən sıxıldı, o vaxt da sıradakı ayə nazil oldu).

**46)** (قُلِ اللّٰهُمَّ فَاطِرَ السَّمٰوَاتِ وَالْاَرْضِ عَالِمَ الْغَيْبِ وَالشَّهَادَةِ) - (Ey Məhəmməd), **müşriklərdən uzaq olub, de ki, ey mənim Allahım və ey göyləri və yeri yoxdan yaradan və ey aşkar və gizli olana agah olan!**

(اَنْتَ تَحْكُمُ بَيْنَ عِبَادِكَ فٖيمَا كَانُوا فٖيهِ يَخْتَلِفُونَ) - **Sən özün bəndələrin arasında - o işdə ki, ixtilaf edirlər, hökm edirsən. Səndən başqa, hökm edən olmaz.** (Mənimlə müşriklər arasında hökm et. Allah-Təala peyğəmbərin duasını qəbul edib, onu müşriklərə qalib etdi).

**47)** (وَلَوْ اَنَّ لِلَّذٖينَ ظَلَمُوا مَا فِي الْاَرْضِ جَمٖيعًا وَمِثْلَهُ مَعَهُ لَافْتَدَوْا بِهٖ مِنْ سُٓوءِ الْعَذَابِ يَوْمَ الْقِيٰمَةِۜ) - (Ey Məhəmməd), **əgər bütün yerdə olan xəzinələr, bir də bir o qədər zalımların olsa, ta ki, qiyamət günündə şiddətli əzabın əvəzinə onları verib, bəlkə əzabdan qurtulsunlar, əlbəttə, onlardan qəbul olunmayacaqdır, halbuki qiyamət günündə heç bir şeyə malik olmayacaqlar.**

(وَبَدَا لَهُمْ مِنَ اللّٰهِ مَا لَمْ يَكُونُوا يَحْتَسِبُونَ) - **Qiyamət günündə zalımlardan ötrü Allah-Təalanın şiddətli əzab və qəzəbi onların gümanlarına gəlməyən qədər açıq-aşkar olacaqdır.**

**48)** (وَبَدَا لَهُمْ سَيِّـَٔاتُ مَا كَسَبُوا وَحَاقَ بِهِمْ مَا كَانُوا بِهٖ يَسْتَهْزِؤُنَ) - **Qiyamət günündə zalımların qarşısında qazandıqları yaman və xəbis əməllər peyda olar və dünyada haqqa istehza etmələrinin cəzası onlara çatıb əhatə edər. O əzabdan xilas ola bilməzlər.**

**49)** (فَاِذَا مَسَّ الْاِنْسَانَ ضُرٌّ دَعَانَاۘ) - (Ey Məhəmməd), **o zaman ki, insana bir zərər və müsibət yetişdi, yalvarıb, inləyib bizə dua edər ki, o bəlanı ondan dəf edək,** (ثُمَّ اِذَا خَوَّلْنَاهُ نِعْمَةً مِنَّاۙ قَالَ اِنَّمَٓا اُوتٖيتُهُ عَلٰى عِلْمٍۜ) - **ondan sonra elə ki o bəlanı ondan götürüb öz bərəkət və rəhmətimizdən ona nemət bəxş etdik, o vaxt da insan bizi unudub deyər: “Bu nemət mənə öz əməlimin səbəbinə verilibdir. Qazanc və ticarət səbəbi ilə bu neməti özüm əldə etmişəm. Allah-**

بَلْ هِيَ فِتْنَةٌ وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَعْلَمُونَ﴿٤٩﴾قَدْ قَالَهَا الَّذٖينَ مِنْ قَبْلِهِمْ فَمَٓا اَغْنٰى عَنْهُمْ مَا كَانُوا
يَكْسِبُونَ ﴿٥٠﴾ فَاَصَابَهُمْ سَيِّـَٔاتُ مَا كَسَبُواۜ وَالَّذٖينَ ظَلَمُوا مِنْ هٰٓؤُلَٓاءِ سَيُصٖيبُهُمْ سَيِّـَٔاتُ مَا كَسَبُواۙ
وَمَا هُمْ بِمُعْجِزٖينَ ﴿٥١﴾ اَوَلَمْ يَعْلَمُٓوا اَنَّ اللّٰهَ يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ وَيَقْدِرُؕ اِنَّ فٖي ذٰلِكَ لَاٰيَاتٍ
لِقَوْمٍ يُؤْمِنُونَ۟ ﴿٥٢﴾ قُلْ يَا عِبَادِيَ الَّذٖينَ اَسْرَفُوا عَلٰٓى اَنْفُسِهِمْ لَا تَقْنَطُوا مِنْ رَحْمَةِ اللّٰهِؕ اِنَّ اللّٰهَ يَغْفِرُ
الذُّنُوبَ جَمٖيعًاۜ اِنَّهُ هُوَ الْغَفُورُ الرَّحٖيمُ ﴿٥٣﴾

---

**Təalaya dəxli yoxdur.** (بَلْ هِيَ فِتْنَةٌ وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَعْلَمُونَ) - (Ey Məhəmməd), **elə deyil ki, deyirlər, bəlkə o neməti bəladan sonra onlara vermək onlardan ötrü imtahandır, görək şükür edirlər, yoxsa yox. Lakin onların əksəriyyəti imtahan edildiklərindən agah olmayıb, bunu öz əməllərinə isnad edərlər.**

**50)** (قَدْ قَالَهَا الَّذٖينَ مِنْ قَبْلِهِمْ فَمَٓا اَغْنٰى عَنْهُمْ مَا كَانُوا يَكْسِبُونَ) - (Ey Məhəmməd), **bu sözü onlardan əvvəl digər şəxslər də (Qarun və onun kimilər) dedilər. Amma öz etiqadları ilə qazandıqları mal onlara heç bir fayda verməyib, hamısına əzab göndərilib, həlak oldular və axirətdə də əzaba düçar olarlar.** (Bunlar da o əvvəlkilər kimi əzaba düçar olacaqlar).

**51)** (فَاَصَابَهُمْ سَيِّـَٔاتُ مَا كَسَبُواۜ) - (Ey Məhəmməd), **əvvəlkilərə qazandıqları əməllərin cəzası yetişdi. Həm dünyada və həm axirətdə əzaba düçar oldular.** (وَالَّذٖينَ ظَلَمُوا مِنْ هٰٓؤُلَٓاءِ سَيُصٖيبُهُمْ سَيِّـَٔاتُ مَا كَسَبُواۙ وَمَا هُمْ بِمُعْجِزٖينَ) - **Sənin ümmətindən də o şəxslər ki, zalım olub, küfr və şirkdə qalıblar, onlara da əvvəlkilər kimi qazandıqları əməllərin cəzası dünya və axirətdə əlbəttə yetişəcəkdir.** (Dünyada müşriklərə əzab yetişməsi Bədir savaşında həqiqət oldu. Axirət əzabına da şübhə yoxdur). (Ey Məhəmməd), **müşrik və asilər Allah-Təalanı aciz edib, onun əzabından qurtulan deyildir.**

**52)** (اَوَلَمْ يَعْلَمُٓوا اَنَّ اللّٰهَ يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ وَيَقْدِرُ) - (Ey Məhəmməd), **bəs xalq agah deyil ki, həqiqətən, Allah-Təala öz hikməti üzrə kimə istəsə ruzisini bol, firavan verər və kimə istəsə az verər, Allah-Təaladan başqa ruzini artırıb, azaltmağa heç kim qadir deyildir.** (اِنَّ فٖي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يُؤْمِنُونَ) **Həqiqətən, bəzilərinə bol, bəzilərinə az ruzi verməkdə Allah-Təalaya iman edən camaatdan ötrü dəlil və sübutlar vardır.**

**53)** (قُلْ يَا عِبَادِيَ الَّذٖينَ اَسْرَفُوا عَلٰٓى اَنْفُسِهِمْ لَا تَقْنَطُوا مِنْ رَحْمَةِ اللّٰهِ ) - (Ey Məhəmməd), **mənim bəndələrimə de ki, Allah-Təala buyurur: "Ey öz nəfslərinə zülm edib, günahda həddini aşan bəndələrim, Allah-Təalanın rəhmətindən ümidsiz olmayıb, tövbə edin.** (اِنَّ اللّٰهَ يَغْفِرُ الذُّنُوبَ جَمٖيعًاۜ) **- Həqiqətən, tövbə edən vaxtda Allah-Təala cəmi günahları bağışlayar, Allahın əfvindən ümidsiz olub, tövbəni tərk etməyin.** (اِنَّهُ هُوَ الْغَفُورُ الرَّحٖيمُ) **- Həqiqətən, Allah-Təala bəndələrinə rəhm edib, tövbə edənləri bağışlayandır.**

وَاَنِيبُوٓا اِلٰى رَبِّكُمْ وَاَسْلِمُوا لَهُ مِنْ قَبْلِ اَنْ يَأْتِيَكُمُ الْعَذَابُ ثُمَّ لَا تُنْصَرُونَ﴿٥٤﴾ وَاتَّبِعُوٓا اَحْسَنَ مَآ
اُنْزِلَ اِلَيْكُمْ مِنْ رَبِّكُمْ مِنْ قَبْلِ اَنْ يَأْتِيَكُمُ الْعَذَابُ بَغْتَةً وَاَنْتُمْ لَا تَشْعُرُونَ ﴿٥٥﴾ اَنْ تَقُولَ نَفْسٌ يَا
حَسْرَتٰى عَلٰى مَا فَرَّطْتُ فِي جَنْبِ اللّٰهِ وَاِنْ كُنْتُ لَمِنَ السَّاخِرِينَ ﴿٥٦﴾ اَوْ تَقُولَ لَوْ اَنَّ اللّٰهَ هَدٰينِي
لَكُنْتُ مِنَ الْمُتَّقِينَ ﴿٥٧﴾ اَوْ تَقُولَ حِينَ تَرَى الْعَذَابَ لَوْ اَنَّ لِي كَرَّةً فَاَكُونَ مِنَ الْمُحْسِنِينَ ﴿٥٨﴾
بَلٰى قَدْ جَآءَتْكَ اٰيَاتِي فَكَذَّبْتَ بِهَا وَاسْتَكْبَرْتَ وَكُنْتَ مِنَ الْكَافِرِينَ﴿٥٩﴾ وَيَوْمَ الْقِيٰمَةِ تَرَى الَّذِينَ
كَذَبُوا عَلَى اللّٰهِ وُجُوهُهُمْ مُسْوَدَّةٌ

---

**54) (وَاَنِيبُوٓا اِلٰى رَبِّكُمْ وَاَسْلِمُوا لَهُ مِنْ قَبْلِ اَنْ يَأْتِيَكُمُ الْعَذَابُ ثُمَّ لَا تُنْصَرُونَ) - Sizə əzab gəlmədən əvvəl tövbə edib rəbbiniz Allah-Təala tərəfinə qayıdıb, əməllərinizi Allah-Təalaya məxsus edin, əzab gələndən sonra sizə kömək olub, əzabı sizdən dəf edən olmaz. Əbədiyyən sizə əzab edilər.**

**55) (وَاتَّبِعُوٓا اَحْسَنَ مَآ اُنْزِلَ اِلَيْكُمْ مِنْ رَبِّكُمْ مِنْ قَبْلِ اَنْ يَأْتِيَكُمُ الْعَذَابُ بَغْتَةً وَاَنْتُمْ لَا تَشْعُرُونَ) - Qəfildən və qafil olduğunuz halda, sizə əzab gəlmədən əvvəl rəbbiniz Allah-Təaladan gələn ən gözəl sözlərə tabe olub, əməl edin ki, nicat tapasınız.**

**56) (اَنْ تَقُولَ نَفْسٌ يَا حَسْرَتٰى عَلٰى مَا فَرَّطْتُ فِي جَنْبِ اللّٰهِ وَاِنْ كُنْتُ لَمِنَ السَّاخِرِينَ) - Əzab gəlməmiş tövbə edin ki, günahkar nəfsə əzab ediləndə deməsin: vay halıma və heyif olsun mənə ki, Allah-Təalanın itaət və ibadətində qüsur edib, asi olub həqiqətən, Allah-Təalanın ehkamına istehza edənlərdən idim".**

**57) (اَوْ تَقُولَ لَوْ اَنَّ اللّٰهَ هَدٰينِي لَكُنْتُ مِنَ الْمُتَّقِينَ) - Ya da ki, günahkar nəfs deməsin: "Əgər Allah-Təala mənə hidayət etsəydi, mən də müttəqilərdən olardım. (Budur, hidayət yolunu ona göstərib, peyğəmbər göndərib, Quran kimi kitabı ona göndərmişəm).**

**58) (اَوْ تَقُولَ حِينَ تَرَى الْعَذَابَ لَوْ اَنَّ لِي كَرَّةً فَاَكُونَ مِنَ الْمُحْسِنِينَ) - Ya da ki, günahkar nəfs deməsin: "Əgər mənim bir dəfə də dünyaya qayıtmaq imkanım olsaydı, hər halda yaxşı əməl sahiblərindən olardım".**

**59) (بَلٰى قَدْ جَآءَتْكَ اٰيَاتِي فَكَذَّبْتَ بِهَا وَاسْتَكْبَرْتَ وَكُنْتَ مِنَ الْكَافِرِينَ) - Günahkar nəfsin bu sözləri deməməsi və üzr istəməməsindən ötrü** (ey Məhəmməd), **peyğəmbər və kitab göndərdik. Bununla belə, əgər günahkar nəfs üzr istəsə, o vaxt ona deyərik ki, sənin üzrün qəbul edilməyibdir, əksinə mənim tövhid və qüdrətimə işarə edən ayələrim sənə gəldi. Sən onu təkzib edib, təkəbbürlənib, itaət etməyib, kafirlərdən oldun. İndi qiyamət günündə əzabı görüb, üzr istəyirsən. Heç bir üzr səndən qəbul edilməyəcəkdir.**

**60) (وَيَوْمَ الْقِيٰمَةِ تَرَى الَّذِينَ كَذَبُوا عَلَى اللّٰهِ وُجُوهُهُمْ مُسْوَدَّةٌ) -** (Ey Məhəmməd), **o şəxslər ki, dünyada Allah-Təalaya yalan qoşub, ona layiq olmayan sifətlər isnad edib, ondan ötrü şərik və övlad təyin etdilər, onların üzlərini qiyamət**

اَلَيْسَ فٖي جَهَنَّمَ مَثْوًى لِلْمُتَكَبِّرٖينَ ﴿٦٠﴾ وَيُنَجِّي اللّٰهُ الَّذٖينَ اتَّقَوْا بِمَفَازَتِهِمْ لَا يَمَسُّهُمُ السُّٓوءُ وَلَا
هُمْ يَحْزَنُونَ ﴿٦١﴾ اَللّٰهُ خَالِقُ كُلِّ شَيْءٍ وَهُوَ عَلٰى كُلِّ شَيْءٍ وَكٖيلٌ ﴿٦٢﴾ لَهُ مَقَالٖيدُ السَّمٰوَاتِ
وَالْاَرْضِ وَالَّذٖينَ كَفَرُوا بِاٰيَاتِ اللّٰهِ اُولٰٓئِكَ هُمُ الْخَاسِرُونَ ﴿٦٣﴾ قُلْ اَفَغَيْرَ اللّٰهِ تَاْمُرُوٓنّٖٓي اَعْبُدُ اَيُّهَا
الْجَاهِلُونَ ﴿٦٤﴾ وَلَقَدْ اُوحِيَ اِلَيْكَ وَاِلَى الَّذٖينَ مِنْ قَبْلِكَ لَئِنْ اَشْرَكْتَ لَيَحْبَطَنَّ عَمَلُكَ وَلَتَكُونَنَّ
مِنَ الْخَاسِرٖينَ ﴿٦٥﴾ بَلِ اللّٰهَ فَاعْبُدْ وَكُنْ مِنَ الشَّاكِرٖينَ ﴿٦٦﴾

---

**günündə qaralmış görərsən. (اَلَيْسَ فٖي جَهَنَّمَ مَثْوًى لِلْمُتَكَبِّرٖينَ) - Necə ola bilər ki, onların üzləri qaralmasın, bəs təkəbbürlənib, iman etməyib, bizi təkzib edənlərdən ötrü cəhənnəmdə mənzil seçilməyibmi? Cəhənnəmə daxil olanın əlbəttə, üzü qaralacaqdır.**

**61) (وَيُنَجِّي اللّٰهُ الَّذٖينَ اتَّقَوْا بِمَفَازَتِهِمْ)** - (Ey Məhəmməd), **qiyamət günündə Allah-Təala mömin şəxsləri məqsəd və arzularına yetişdirməklə əzabdan nicat verər. (لَا يَمَسُّهُمُ السُّٓوءُ وَلَا هُمْ يَحْزَنُونَ) Heç bir çirkin iş və təbiətlərinə zidd olan şey onlara yetişməyib, qəmgin də olmazlar.**

**62) (اَللّٰهُ خَالِقُ كُلِّ شَيْءٍ وَهُوَ عَلٰى كُلِّ شَيْءٍ وَكٖيلٌ)** - (Ey Məhəmməd), **hər bir şeyin xaliqi, yaradıcısı Allah-Təaladır və hər bir şeyi meydana gələndən sonra qoruyub saxlayan da Allah-Təaladır. Heç bir şey Allah-Təalanın qüdrətindən kənar olmaz.**

**63) (لَهُ مَقَالٖيدُ السَّمٰوَاتِ وَالْاَرْضِ) - Göylərin və yerin xəzinələrinin açarı Allah-Təalaya məxsusdur. Onların hər bir işinə sahib olub qoruyan da Allah-Təaladır. (وَالَّذٖينَ كَفَرُوا بِاٰيَاتِ اللّٰهِ اُولٰٓئِكَ هُمُ الْخَاسِرُونَ)** - (Ey Məhəmməd), **o şəxslər ki, Allah-Təalanın tövhid və qüdrətinə işarə edən ayələrə və sübuta qulaq asmayıb, kafir olar, əlbəttə, onlar öz nəfslərinə ziyan verənlərdir.**

**64) (قُلْ اَفَغَيْرَ اللّٰهِ تَاْمُرُوٓنّٖٓي اَعْبُدُ اَيُّهَا الْجَاهِلُونَ)** - (Ey Məhəmməd), **müşriklərə de ki, ey cahillər, bəs Allah-Təaladan başqa bütlərə ibadət etməyi mənə əmr edirsiniz?**

**65) (وَلَقَدْ اُوحِيَ اِلَيْكَ وَاِلَى الَّذٖينَ مِنْ قَبْلِكَ لَئِنْ اَشْرَكْتَ لَيَحْبَطَنَّ عَمَلُكَ وَلَتَكُونَنَّ مِنَ الْخَاسِرٖينَ) -** (Necə ola bilər, mən sizin bütlərə ibadət edim? Və halbuki Allah-Təala mənə buyurur: "Ey Məhəmməd), **sənə və səndən əvvəlki peyğəmbərlərə bizim tərəfimizdən vəhy olunubdur.** (Bu vəhy peyğəmbərlərə və digər müvəhhidlərə Allah-Təalanın verdiyi ağıl dəlilindən ibarətdir). **Əgər Allah-Təalaya şərik qoşsan, hər halda əlbəttə, sənin hər bir xeyir əməlin batil olub və əlbəttə, öz nəfsinə ziyan verən şəxslərdən olacaqsan ki, o ziyan səbəbinə axirət əzabı səni tutacaqdır.**

**66) (بَلِ اللّٰهَ فَاعْبُدْ وَكُنْ مِنَ الشَّاكِرٖينَ) - bəlkə** (Ey Məhəmməd), **yalnız Allah-Təalaya ibadət edib, şükür edənlərdən ol.** (Ey müşriklər necə olur ki, Allah-

وَمَا قَدَرُوا اللّٰهَ حَقَّ قَدْرِهٖ ۗ وَالْاَرْضُ جَمٖيعًا قَبْضَتُهُ يَوْمَ الْقِيٰمَةِ وَالسَّمٰوَاتُ مَطْوِيَّاتٌ بِيَمٖينِهٖ ۜ سُبْحَانَهُ وَتَعَالٰى عَمَّا يُشْرِكُونَ ﴿٦٧﴾ وَنُفِخَ فِي الصُّورِ فَصَعِقَ مَنْ فِي السَّمٰوَاتِ وَمَنْ فِي الْاَرْضِ اِلَّا مَنْ شَٓاءَ اللّٰهُ ۜ ثُمَّ نُفِخَ فٖيهِ اُخْرٰى فَاِذَا هُمْ قِيَامٌ يَنْظُرُونَ ﴿٦٨﴾

---

Təalanın əmrini və sizin kimi nadan və cahillərə göstərdiyi ağıl dəlilini tərk edib, tabe olmursunuz? Tabe olun!)

**67) (وَمَا قَدَرُوا اللّٰهَ حَقَّ قَدْرِهٖ) -** (Ey Məhəmməd), **insan nəsli Allah-Təalanın şanına layiq şəkildə ona təzim və hörmət etməyib, haqqa arif olmayıb, tövhidi tərk edib ona şərik qoşdular.**

**(وَالْاَرْضُ جَمٖيعًا قَبْضَتُهُ يَوْمَ الْقِيٰمَةِ وَالسَّمٰوَاتُ مَطْوِيَّاتٌ بِيَمٖينِهٖ ۜ) -** (Ey Məhəmməd), **halbuki Allah-Təalanın kamil qüdrəti qiyamət günündə elə bir səviyyədə zühur edər ki, bu yer öz əzəmətinə baxmayaraq Allah-Təalanın* ovcunun içində olar.** (Necə ki, bir şəxs bir ovuc torpaq götürər) **və göylər də onun sağ əlilə bükülər.** (Necə ki, kağız bükülür). **Bunların hamısı Allah-Təalanın qüdrətinə tabedir.**

*(*__Qeyd:__ "Bu ayə bizim adət-ənənə üzrə Allah-Təalanın qüdrət və əzəmətini bizim xəyalımızda təsvir edib, bizə məlum etməkdən ötrüdür, yoxsa həqiqətən, onun nə ovcu, nə sağ, nə də sol əli, heç biri yoxdur. Bəlkə necə ki, bizim adətimizdə bir ovuc torpağı yerdən götürəndə ya da ki, bir kağızı bükəndə ona necə sahibsənsə, habelə Allah-Təala da öz qüdrətilə yerə və göylərə və onlarda olan məxluqata elə sahibdir. (Bəlağət elminə sahib olan alimlər bu ayənin böyüklüyünə, fəsahət və bəlağətinə agah olub, Allah-Təalanın əsər və əzəmətinə işarə etməsini fəhm edirlər. Nəinki bəzi həşviyələr (məzhəb adı) kimi ayəni Allah-Təalanın cism olmağına dəlil sayıb, ondan ötrü əl, ayaq, göz və digər insan əzası kimi orqanlar təyin edib, qiyamət günündə gəlib, hakimiyyət taxtında oturub, xalq arasında hökm etməyinə inanırlar. Allah-Təala zalımların dediyi sözlərdən uca və böyükdür).*

**(سُبْحَانَهُ وَتَعَالٰى عَمَّا يُشْرِكُونَ) - O şeyləri ki Allah-Təalaya şərik sayırlar, Allah-Təala onlardan pak və ucadır. Heç bir şey Allah-Təalaya şərik ola bilməz.**

**68) (وَنُفِخَ فِي الصُّورِ فَصَعِقَ مَنْ فِي السَّمٰوَاتِ وَمَنْ فِي الْاَرْضِ اِلَّا مَنْ شَٓاءَ اللّٰهُ) -** (Ey Məhəmməd), **qiyamət günündən əvvəl dünyada cəmi həyat sahiblərinin surətlərinə bizim tərəfimizdən** (əcəl üfləməsi) **üflənilər, o vaxt Allah-Təalanın sağ qalmasını istədiklərindən (müqəddəs ruhlardan) başqa, göylərdə və yerdə olan həyat sahiblərinin hamısı həlak olarlar.**

**(ثُمَّ نُفِخَ فٖيهِ اُخْرٰى فَاِذَا هُمْ قِيَامٌ يَنْظُرُونَ) - Bir qədər keçəndən sonra Allah-Təala öz kamil qüdrəti ilə o məhv olmuş surətlərin hər birinə yenidən qəfildən üfləyər** (həyat üfləyər), **hamısı dirilib, durub çaşqın şəkildə ətraflarına baxarlar.**

وَاَشْرَقَتِ الْاَرْضُ بِنُورِ رَبِّهَا وَوُضِعَ الْكِتَابُ وَجِيٓءَ بِالنَّبِيِّنَ وَالشُّهَدَٓاءِ وَقُضِيَ بَيْنَهُمْ بِالْحَقِّ وَهُمْ لَا
يُظْلَمُونَ ﴿٦٩﴾ وَوُفِّيَتْ كُلُّ نَفْسٍ مَا عَمِلَتْ وَهُوَ اَعْلَمُ بِمَا يَفْعَلُونَ ﴿٧٠﴾ وَسِيقَ الَّذِينَ كَفَرُوٓا اِلٰى
جَهَنَّمَ زُمَرًاۜ حَتّٰٓى اِذَا جَٓاؤُهَا فُتِحَتْ اَبْوَابُهَا وَقَالَ لَهُمْ خَزَنَتُهَٓا اَلَمْ يَاْتِكُمْ رُسُلٌ مِنْكُمْ يَتْلُونَ عَلَيْكُمْ
اٰيَاتِ رَبِّكُمْ وَيُنْذِرُونَكُمْ لِقَٓاءَ يَوْمِكُمْ هٰذَاۜ قَالُوا بَلٰى وَلٰكِنْ حَقَّتْ كَلِمَةُ الْعَذَابِ عَلَى الْكَافِرِينَ
﴿٧١﴾ قِيلَ ادْخُلُوٓا اَبْوَابَ جَهَنَّمَ خَالِدِينَ فِيهَاۚ فَبِئْسَ مَثْوَى الْمُتَكَبِّرِينَ﴿٧٢﴾

---

**69) (وَاَشْرَقَتِ الْاَرْضُ بِنُورِ رَبِّهَا)** - (Ey Məhəmməd), **elə ki insanlar dirilib, məhşərə hazır oldular, məhşər günündə yer üzü öz rəbbi Allah-Təalanın nuru** (ədaləti) **ilə işıqlanar.** (Necə ki indi də işıqlanır). **Haqq və ədalətlə xalqın arasında hökm edər. (وَوُضِعَ الْكِتَابُ وَجِيٓءَ بِالنَّبِيِّنَ وَالشُّهَدَٓاءِ) - İnsanların məktublarda qeyd olunan əməlləri haqq-hesaba çəkilər. Peyğəmbərlər və onlardan başqa insanların əməllərinə şahid olan Allah-Təalanın seçilmiş bəndələri orada hazır olub, ədalət divanı qurular.**

**(وَقُضِيَ بَيْنَهُمْ بِالْحَقِّ وَهُمْ لَا يُظْلَمُونَ) - Onların arasında haqq və ədalətlə hökm olunub, heç vaxt onlara zülm olunmaz.**

**70) (وَوُفِّيَتْ كُلُّ نَفْسٍ مَا عَمِلَتْ وَهُوَ اَعْلَمُ بِمَا يَفْعَلُونَ) - Hər bir nəfsə xeyir və şər əməlinin qarşılığı tamamən verilər. Əməllərindən heç bir şey gizli qalmaz. Allah-Təala özü onların etdiyi əməllərə agahdır.** (Kağıza və şahidə ehtiyacı yoxdur, lakin insanlara anlatmaqdan ötrü kağız və şahiddən bəhs olunur).

**71) (وَسِيقَ الَّذِينَ كَفَرُوٓا اِلٰى جَهَنَّمَ زُمَرًاۜ حَتّٰٓى اِذَا جَٓاؤُهَا فُتِحَتْ اَبْوَابُهَا)** - (Ey Məhəmməd), **qiyamət günündə kafirləri dəstə-dəstə bir-birinin ardınca zorla cəhənnəmə tərəf apararlar.** (Necə ki, əsirləri aparırlar). **Elə ki, gedib cəhənnəmə yetişdilər, cəhənnəmin qapıları onlardan ötrü açılar.**

**(وَقَالَ لَهُمْ خَزَنَتُهَٓا اَلَمْ يَاْتِكُمْ رُسُلٌ مِنْكُمْ يَتْلُونَ عَلَيْكُمْ اٰيَاتِ رَبِّكُمْ وَيُنْذِرُونَكُمْ لِقَٓاءَ يَوْمِكُمْ هٰذَاۜ)- Qapılar açılandan sonra cəhənnəm mühafizləri onların qabağına çıxıb, onlara deyərlər: "Özünüzü necə əzaba düçar etdiniz? Bəs sizə peyğəmbərlər gəlib, Allah-Təalanın ayələrini oxumayıb, belə bir günün əzabı ilə qarşılaşmaqla qorxutmadılarmı? (قَالُوا بَلٰى وَلٰكِنْ حَقَّتْ كَلِمَةُ الْعَذَابِ عَلَى الْكَافِرِينَ) - Onlar cəhənnəm mühafizlərinin cavabında deyərlər: "Bəli, bizə peyğəmbərlər gəlib, Allah-Təalanın əzabı ilə bizi qorxutdular. Lakin bizim xəbis əməllərimizə görə Allah-Təalanın əzabı bizim kimi kafirlərə layiq olub, əzaba haqq qazandıq.**

**72) (قِيلَ ادْخُلُوٓا اَبْوَابَ جَهَنَّمَ خَالِدِينَ فِيهَاۚ فَبِئْسَ مَثْوَى الْمُتَكَبِّرِينَ) - Bu sual-cavabdan sonra kafirlərə cəhənnəm mühafizləri deyərlər: "İndi cəhənnəm qapılarının hansından istəyirsiniz daxil olun, qapılar üzünüzə açıqdır. Bunu da bilin ki, bu cəhənnəmdə əbədi qalacaqsınız. Təkəbbürlənib, Allah-Təalaya**

وَسِيقَ الَّذِينَ اتَّقَوْا رَبَّهُمْ اِلَى الْجَنَّةِ زُمَرًاۜ حَتّٰى اِذَا جَٓاؤُ۫هَا وَفُتِحَتْ اَبْوَابُهَا وَقَالَ لَهُمْ خَزَنَتُهَا سَلَامٌ عَلَيْكُمْ طِبْتُمْ فَادْخُلُوهَا خَالِدِينَ ﴿٧٣﴾ وَقَالُوا الْحَمْدُ لِلّٰهِ الَّذ۪ي صَدَقَنَا وَعْدَهُ وَاَوْرَثَنَا الْاَرْضَ نَتَبَوَّاُ مِنَ الْجَنَّةِ حَيْثُ نَشَٓاءُۚ فَنِعْمَ اَجْرُ الْعَامِل۪ينَ ﴿٧٤﴾ وَتَرَى الْمَلٰٓئِكَةَ حَٓافّ۪ينَ مِنْ حَوْلِ الْعَرْشِ يُسَبِّحُونَ بِحَمْدِ رَبِّهِمْۚ وَقُضِيَ بَيْنَهُمْ بِالْحَقِّ وَق۪يلَ الْحَمْدُ لِلّٰهِ رَبِّ الْعَالَم۪ينَ ﴿٧٥﴾

---

**iman etməyənlərin yeri cəhənnəmdir. Nə yaman yerdir cəhənnəm ki, həmişə əzab içində olacaqsınız.**

**73) (وَسِيقَ الَّذِينَ اتَّقَوْا رَبَّهُمْ اِلَى الْجَنَّةِ زُمَرًاۜ) -** (Ey Məhəmməd), **rəbləri Allah-Təaladan qorxub, xeyir əməl edənləri qiyamət günündə dəstə-dəstə izzət və ehtiramla cənnətə tərəf apararlar. (حَتّٰى اِذَا جَٓاؤُ۫هَا وَفُتِحَتْ اَبْوَابُهَا) - Elə ki, gedib cənnətə yetişdilər, elə bir halda yetişərlər ki, onlardan əvvəl cənnətin qapıları onlardan ötrü açılıb, hazır olub, onların gəlməsini gözləyər. (وَقَالَ لَهُمْ خَزَنَتُهَا سَلَامٌ عَلَيْكُمْ طِبْتُمْ فَادْخُلُوهَا خَالِدِينَ) - Elə ki gəlib yetişdilər, cənnətin mühafizləri onları qarşılayıb, əvvəlcə onlara salam verib, sonra deyərlər: "Nə gözəl, ulu şəxslərsiniz, günah və müsibətin xəbisliyindən pak oldunuz. Bu cənnət pakların məqamı olduğuna görə, cənnətə daxil olun. Bir halda ki, Allah-Təala sizdən ötrü təyin edibdir, gərək, cənnətdə həmişəlik qalıb, ölümü dadmayasınız, nə də oradan çıxmayacaqsınız".**

**74) (وَقَالُوا الْحَمْدُ لِلّٰهِ الَّذ۪ي صَدَقَنَا وَعْدَهُ وَاَوْرَثَنَا الْاَرْضَ) - O vaxt da möminlər cənnət mühafizlərinin müjdəsindən şad olub, Allah-Təalaya həmd-səna etməyə başlayıb deyərlər: həmd olsun Allah-Təalaya ki, bizə dünyada verdiyi cənnət vədini doğru etdi. Budur, cənnət yerinə bizi** (varislər miraslarına malik olan kimi) **malik və sahib təyin etdi.**

**( نَتَبَوَّاُ مِنَ الْجَنَّةِ حَيْثُ نَشَٓاءُۚ فَنِعْمَ اَجْرُ الْعَامِل۪ينَ) - Bu cənnətə bizi elə sahib edibdir ki, cənnətin hansı guşəsində istəsək, mənzil tutub, istirahət etməyə ixtiyarımız vardır. Dünyada bizim xeyir əməlimizə görə Allah-Təala bu mərhəməti bizə bəxş edib. Xeyir əməl edənlərin əcr və savabları nə gözəl şeydir.**

**75) (وَتَرَى الْمَلٰٓئِكَةَ حَٓافّ۪ينَ مِنْ حَوْلِ الْعَرْشِ يُسَبِّحُونَ بِحَمْدِ رَبِّهِمْ) -** (Ey Məhəmməd), **qiyamət günündə mələkləri** (müqəddəs ruhları) **görərsən, necə Allah-Təalanın qüdrət və əzəmət taxtını əhatə edib həmd-səna və "təsbih" edib** (Allah nə ucadır – deyib), **Allah-Təalanı yad edirlər. (وَقُضِيَ بَيْنَهُمْ بِالْحَقِّ) Məlaikə arasında da insanlar kimi haqq və ədalətlə hökm olunar. Hər birinin itaət və ibadətinə və bilik səviyyəsinə görə ona bir dərəcə bəxş olunar. (وَق۪يلَ الْحَمْدُ لِلّٰهِ رَبِّ الْعَالَم۪ينَ) - İnsanlar və məlaikə Allah-Təalanın zikri ilə məşğul olub deyərlər: "Aləmlərə nizam verən Allah-Təalaya həmd olsun ki, bizlərə əzabdan nicat verib, belə gözəl nemətləri bizə bəxş**

etdi”. Biz də deyirik: “Allaha həmd olsun, bu mübarək surənin təfsirini bitirməyə müvəffəq olduq.” Bu surə müjdələməyi və qorxutmağı ehtiva edən surədir. Müjdə və təhdid avam camaatın insanlıq və gözəl əxlaq əldə etməsi üçün Allah-Təalanın iki qamçısıdır. Vaiz və nəsihətçilər gərək həmişə bu ayələri öyüd-nəsihət edib, avamlara dinlətsinlər ki, onları vəhşilik və cəhalətdən çıxarıb, insanlığa daxil etsinlər. Qurani-Şərifdə insan nəslinin hər bir xasiyyətdə olan fərdinə görə öyüd-nəsihət mövcuddur. Cənnət və cəhənnəm, xüsusən tamahkar və qorxanlardan ötrü böyük nəsihətdir.

Necə ki təfəkkür sahiblərinə bu iş gizli deyildir. Allahın Rəsulu buyurubdur: “Hər şəxs ki Zümər surəsini oxusa, Allah-Təala onun ümidini qiyamət günündə qırmaz”. Möminlərin anası Aişədən rəvayət olunubdur. Deyir: “Allahın Rəsulu hər gecə İsra və Zümər surələrini oxuyardı”.

## əl-MÖMİN SURƏSİ

40-cı surədir. Məkkədə nazil olub, 82 ayə, 1199 kəlmə və 4960 hərfdir.

حٰمٓ ﴿١﴾ تَنْزِيلُ الْكِتَابِ مِنَ اللّٰهِ الْعَزِيزِ الْعَلِيمِ ﴿٢﴾

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (حٰمٓ)* Bu mübarək surənin adıdır.**

**2) (تَنْزِيلُ الْكِتَابِ مِنَ اللّٰهِ الْعَزِيزِ الْعَلِيمِ) -** (Ey Məhəmməd), **bu kitab** (Quran) **hər bir şeyə agah və məxluqata qalib olan və onları qəhr edən Allah-Təala tərəfindən göndərilibdir.**

*(***Qeyd:** II xəlifə Ömər ibn Xəttab öz xilafəti zamanında Şam əhlindən olan ordu sərkərdələrindən bir şücaətli kişini bir neçə gün görmədi. Soruşdu ki, filankəs haradadır? Dedilər: "Şərab içməklə məşğuldur". Ömər katibinə əmr etdi ki, ona bu məzmunda yaz. Ömərin yazdığını eynən nəql edib ondan sonra tərcüməsini verək.*

*Mənası belədir: "Bu kağız Ömərdəndir, filankəsə salam olsun. Bu kağızı sənə yazmaqla yeganə olan Allah-Təalaya həmd edirəm. Ondan sonra necə ki, bəhs olundu, mübarək surənin əvvəlindən "ileyhil-məsir"ə qədər yazdı. Ondan sonra kağıza möhür vurub, xidmətçisinə verib dedi: "Bu kağızı o şəxsə elə bir halda verərsən ki, ağlı, şüuru başında olsun. Ondan sonra xidmətçiyə dedi: "Mənim tərəfimdən ona de ki, tövbə edib Allah-Təalanın tərəfinə qayıtsın. Xidmətçi kağızı aparıb o şəxsə ayıq halında verdi. Kağızı oxuyandan sonra dedi: "Allah-Təala mənə vəd edir ki, bağışlasın və əzabı ilə məni qorxudur. Ağlayana qədər bir neçə dəfə bu sözü dedi. Ondan sonra tövbə edib gözəl şəkildə tövbəsini qorudu. Elə ki, onun tövbə xəbəri xəlifə Ömərə yetişdi, hazır olanlara dedi: "Nə zaman ki, gördünüz, bir mömin qardaşınız xəta edib, günaha batıb, onunla mənim kimi rəftar edin. Nəsihət edib onu o əməldən saxlayın, dua edin ki, Allah-Təala onun tövbəsini qəbul etsin. Şeytanlara kömək olub, o xəbis əmələ onu daha çox vadar etməyin". Xeyri əmr, şəri qadağan etmə üsuluna arif olanlar gərək belə rəftar etsinlər. Arif olmayanlar onlardan gərək nümunə götürsünlər. Nəinki adlarını nəsihətçi və vaiz qoyanlar məscidlərdə Allah sözünün xilafını danışıb, fasiqlərin işlətdiyi əxlaqsız sözləri istifadə edib, özlərini xeyri əmr edən, şəri qadağan edən saysınlar. Necə ki, bizim bu zamanda əksər vaizlərin adətidir. Bu yol vəz və nəsihət yoludurmu?*

**غَافِرِ الذَّنْبِ وَقَابِلِ التَّوْبِ شَدِيدِ الْعِقَابِ ذِي الطَّوْلِ لَٓا اِلٰهَ اِلَّا هُوَ اِلَيْهِ الْمَصِيرُ ﴿٣﴾ مَا يُجَادِلُ فِيٓ اٰيَاتِ اللّٰهِ اِلَّا الَّذِينَ كَفَرُوا فَلَا يَغْرُرْكَ تَقَلُّبُهُمْ فِي الْبِلَادِ ﴿٤﴾ كَذَّبَتْ قَبْلَهُمْ قَوْمُ نُوحٍ وَالْاَحْزَابُ مِنْ بَعْدِهِمْ وَهَمَّتْ كُلُّ اُمَّةٍ بِرَسُولِهِمْ لِيَاْخُذُوهُ وَجَادَلُوا بِالْبَاطِلِ لِيُدْحِضُوا بِهِ الْحَقَّ فَاَخَذْتُهُمْ فَكَيْفَ كَانَ عِقَابِ ﴿٥﴾**

---

*Belə şəxslər xalqa hidayət edib zəlalətdən çıxara bilərmi? Heyhat, şəxsin özü buna agah olmaya-olmaya, başqasını necə dəvət etsin? Halbuki Allah-Təala Qurani-Şərifdə uca peyğəmbərə ən gözəl şəkildə xalqa vəz, nəsihət etməyi əmr edibdir. Həmin yolu da səhabələr o cənabdan öyrənib, istifadə edirdilər. Necə ki, II xəlifədən nəql olundu. Vaizlər və nəsihətçilər gərək özləri Qurani-Şərifin öyüd-nəsihətləri ilə tərbiyələnib, ondan sonra xalqa nəsihət etsinlər. Özün nəsihət qəbul etməmisən, başqalarına nəsihət vermə. Allah-Təala hidayət yoluna sövq edəndir).*

**3) (غَافِرِ الذَّنْبِ وَقَابِلِ التَّوْبِ) - Allah-Təala tövbəni qəbul edib, günahı bağışlayandır. (شَدِيدِ الْعِقَابِ) - Ona asi olub, şirk qoşanlara da əzab etməkdə son dərəcə şiddətlidir. (ذِي الطَّوْلِ لَٓا اِلٰهَ اِلَّا هُوَ اِلَيْهِ الْمَصِيرُ) - Müvəhhid və ariflərə mərhəmət sahibidir. Öz əməllərindən artıq onlara əcr və savab bəxş edər. Yeganə Allah-Təaladan başqa haqq məbud yoxdur. Ölüm insanlığa gələndən sonra hamının qayıdacağı yer onun tərəfinə olub, hər bir şəxsin əməlinə görə, ona qarşılıq verəcəkdir.**

**4-5) (مَا يُجَادِلُ فِيٓ اٰيَاتِ اللّٰهِ اِلَّا الَّذِينَ كَفَرُوا) -** (Ey Məhəmməd), **Allah-Təalanın göndərdiyi ayələrə kafir şəxslərdən başqası tənə edib, batil etmək üçün mücadilə etməz.** (Necə ki, Qüreyş camaatı Quran haqqında Allahın Rəsulu ilə dalaşırdılar). **(فَلَا يَغْرُرْكَ تَقَلُّبُهُمْ فِي الْبِلَادِ) -** (Ey Məhəmməd), **Quranı təkzib edən Qüreyş tayfasının vilayətlərində sağ-salamat gəzib, ticarət edib, mənfəət qazanmaları səni aldatmasın. Hərçənd indi onların işi yaxşı gedır, lakin həm dünya, həm də axirətdə aqibətləri bədbəxtlik və əbədi əzab olacaqdır. (كَذَّبَتْ قَبْلَهُمْ قَوْمُ نُوحٍ وَالْاَحْزَابُ مِنْ بَعْدِهِمْ) - Qüreyş camaatından qabaq Nuh peyğəmbərin xalqı Nuhu və onlardan sonra gələn ümmətlər də öz peyğəmbərlərini təkzib etdilər. (**Necə ki, ey Məhəmməd, bu Qüreyş tayfası səni təkzib edir). **(وَهَمَّتْ كُلُّ اُمَّةٍ بِرَسُولِهِمْ لِيَاْخُذُوهُ) - Əvvəlki ümmətlər öz peyğəmbərlərini tutub, əzab verməyə cəhd etdilər.** (Necə ki, ey Məhəmməd, bu Qüreyş camaatı cəhd edir). **(وَجَادَلُوا بِالْبَاطِلِ لِيُدْحِضُوا بِهِ الْحَقَّ) - Batil sözləri bəhanə edib, peyğəmbərləri ilə mücadilə etdilər ki, o sözləri ilə haqqı batil və məhv etsinlər.** (Necə ki, bu Qüreyş tayfası ey Məhəmməd), **Quranın müqabilində batil və boş sözlərə yapışıb, Qurana gah şeir, gah da sehr deyirlər ki, onu batil etsinlər). (فَاَخَذْتُهُمْ فَكَيْفَ كَانَ عِقَابِ) -** (Ey Məhəmməd), **onlar peyğəmbərləri tutub, əzab etməyə cəhd etdilər. Lakin mən peyğəmbərləri mühafizə edib, onları həlak etdim. Bax, gör ki, mənim onlara olan əzabım necə oldu. Xilas olub, mənim əzabımdan qurtula**

وَكَذٰلِكَ حَقَّتْ كَلِمَتُ رَبِّكَ عَلَى الَّذِينَ كَفَرُوٓا اَنَّهُمْ اَصْحَابُ النَّارِ ﴿٦﴾ اَلَّذِينَ يَحْمِلُونَ الْعَرْشَ
وَمَنْ حَوْلَهُ يُسَبِّحُونَ بِحَمْدِ رَبِّهِمْ وَيُؤْمِنُونَ بِهِ وَيَسْتَغْفِرُونَ لِلَّذِينَ اٰمَنُوا رَبَّنَا وَسِعْتَ كُلَّ شَيْءٍ رَحْمَةً
وَعِلْمًا فَاغْفِرْ لِلَّذِينَ تَابُوا وَاتَّبَعُوا سَبِيلَكَ وَقِهِمْ عَذَابَ الْجَحِيمِ ﴿٧﴾ رَبَّنَا وَاَدْخِلْهُمْ جَنَّاتِ عَدْنٍ
الَّتِي وَعَدْتَهُمْ وَمَنْ صَلَحَ مِنْ اٰبَائِهِمْ وَاَزْوَاجِهِمْ وَذُرِّيَّاتِهِمْ اِنَّكَ اَنْتَ الْعَزِيزُ الْحَكِيمُ ﴿٨﴾ وَقِهِمُ
السَّيِّاٰتِ وَمَنْ تَقِ السَّيِّاٰتِ يَوْمَئِذٍ فَقَدْ رَحِمْتَهُ وَذٰلِكَ هُوَ الْفَوْزُ الْعَظِيمُ ﴿٩﴾ اِنَّ الَّذِينَ كَفَرُوا يُنَادَوْنَ
لَمَقْتُ اللّٰهِ اَكْبَرُ مِنْ مَقْتِكُمْ اَنْفُسَكُمْ اِذْ تُدْعَوْنَ اِلَى الْاِيمَانِ فَتَكْفُرُونَ ﴿١٠﴾

---

**bildilərmi? Habelə Qüreyş camaatını da qəflətən yaxalayıb, əzab edəcəyəm.**

**6)** (وَكَذٰلِكَ حَقَّتْ كَلِمَتُ رَبِّكَ عَلَى الَّذِينَ كَفَرُوٓا اَنَّهُمْ اَصْحَابُ النَّارِ) **-** (Ey Məhəmməd), **necə ki əvvəlki ümmətlərə bizim əzabımız vacib və haqq oldu, habelə Qurana kafir olan camaata da vacib və haqq oldu. Həqiqətən, onlar cəhənnəm yoldaşıdırlar, həmişə əzab içində qalacaqlar.**

**7)** (اَلَّذِينَ يَحْمِلُونَ الْعَرْشَ وَمَنْ حَوْلَهُ يُسَبِّحُونَ بِحَمْدِ رَبِّهِمْ وَيُؤْمِنُونَ بِهِ) **- O mələklər** (müqəddəs ruhlar) **ki, Allah-Təalanın qüdrət və əzəmət səltənətinin taxtını daşıyarlar və taxtın ətrafında səf-səf duran mələklər öz rəbləri Allah-Təalanı zikr edib, "Allah nə ucadır və ona həmd edirəm" deyib, iman edib, Allah-Təalanın əmr və qadağalarına itaət edərlər.**

(وَيَسْتَغْفِرُونَ لِلَّذِينَ اٰمَنُوا) **- Mələklər özləri iman etməkdən əlavə iman edən insanlardan ötrü də əfv istəyərlər.** (رَبَّنَا وَسِعْتَ كُلَّ شَيْءٍ رَحْمَةً) **- Dua məqamında belə deyərlər: "Ey bizim rəbbimiz, sənin elm və rəhmətin geniş olub, hər bir şeyi əhatə edibdir".** (وَعِلْمًا فَاغْفِرْ لِلَّذِينَ تَابُوا وَاتَّبَعُوا سَبِيلَكَ وَقِهِمْ عَذَابَ الْجَحِيمِ) **- Ey bizim rəbbimiz, o şəxslər ki, çirkin əməllərdən tövbə edib sənin haqq yoluna tabe olublar, onları bağışlayıb cəhənnəm əzabından mühafizə et.**

**8)** (رَبَّنَا وَاَدْخِلْهُمْ جَنَّاتِ عَدْنٍ الَّتِي وَعَدْتَهُمْ وَمَنْ صَلَحَ مِنْ اٰبَائِهِمْ وَاَزْوَاجِهِمْ وَذُرِّيَّاتِهِمْ اِنَّكَ اَنْتَ الْعَزِيزُ الْحَكِيمُ)**-** (Mələikə deyir:) **ey bizim rəbbimiz, o cənnətlər ki, tövbə edib haqq yoluna tabe olanlara və onların ata babalarından və arvadlarından və övladlarından saleh olan şəxslərə vəd edibsən, onların hamısını o cənnətlərə daxil et. Həqiqətən, cəmi məxluqata qalibsən və hər bir əməl səndən hikmət üzrə meydana gəlir.**

**9)** (وَقِهِمُ السَّيِّاٰتِ) **- Ey bizim rəbbimiz, tövbə edənləri günahlarının əzabından mühafizə edib qoru.** (وَمَنْ تَقِ السَّيِّاٰتِ يَوْمَئِذٍ فَقَدْ رَحِمْتَهُ وَذٰلِكَ هُوَ الْفَوْزُ الْعَظِيمُ) **-Və hər bir şəxsi ki, bu günkü gündə (qiyamət günündə) əzabdan mühafizə edəsən, həqiqətən ona rəhm edibsən. Sənin bu rəhmətin böyük nicat tapmaqdır.**

**10)** (اِنَّ الَّذِينَ كَفَرُوا يُنَادَوْنَ لَمَقْتُ اللّٰهِ اَكْبَرُ مِنْ مَقْتِكُمْ اَنْفُسَكُمْ اِذْ تُدْعَوْنَ اِلَى الْاِيمَانِ فَتَكْفُرُونَ) **-**(Ey Məhəmməd), **həqiqətən, o şəxslər ki, dünyada kafir oldular, elə ki**

قَالُوا رَبَّنَآ اَمَتَّنَا اثْنَتَيْنِ وَاَحْيَيْتَنَا اثْنَتَيْنِ فَاعْتَرَفْنَا بِذُنُوبِنَا فَهَلْ اِلٰى خُرُوجٍ مِنْ سَبِيلٍ ﴿١١﴾ ذٰلِكُمْ بِاَنَّهُ اِذَا دُعِيَ اللّٰهُ وَحْدَهُ كَفَرْتُمْ ۚ وَاِنْ يُشْرَكْ بِهِ تُؤْمِنُواۜ فَالْحُكْمُ لِلّٰهِ الْعَلِيِّ الْكَبِيرِ ﴿١٢﴾ هُوَ الَّذِي يُرِيكُمْ اٰيَاتِهِ وَيُنَزِّلُ لَكُمْ مِنَ السَّمَٓاءِ رِزْقًاۜ وَمَا يَتَذَكَّرُ اِلَّا مَنْ يُنِيبُ ﴿١٣﴾ فَادْعُوا اللّٰهَ مُخْلِصِينَ لَهُ الدِّينَ وَلَوْ كَرِهَ الْكَافِرُونَ ﴿١٤﴾

---

**qiyamət günündə əməllərinin müqabilində əzab gördülər, öz nəfslərinə şiddətli düşmən olarlar ki, niyə bizdən belə xilaf əməllər meydana gəldi? O vaxt da bizim tərəfimizdən onlara belə deyilər: “O zaman ki, dünyada bizim peyğəmbərlərimiz sizi imana dəvət edirdi, siz kafir olub qəbul etmirdiniz, o vaxt Allah-Təalanın sizin nəfsinizə olan düşmənçiliyi bugünkü gündə sizin öz nəfsinizə olan düşmənçiliyinizdən daha artıq idi. Nədən ötrü Allah-Təalanın düşmənçiliyindən çəkinib haqqa tabe olmadınız ki, bugünkü gündə əzaba düçar olmayaydınız.**

**11) (قَالُوا رَبَّنَآ اَمَتَّنَا اثْنَتَيْنِ وَاَحْيَيْتَنَا اثْنَتَيْنِ) - O vaxt kafirlər cavab verib deyərlər: “Ey bizim rəbbimiz, öldürüb həyat vermək sənin qüdrətində imiş*. İki dəfə bizi öldürüb və iki dəfə həyat verdin. İndi sənin qadir olmağına agah olduq. (فَاعْتَرَفْنَا بِذُنُوبِنَا فَهَلْ اِلٰى خُرُوجٍ مِنْ سَبِيلٍ) - Günahlarımızı iqrar edib, özümüzü günahkar bilirik, bəs indi bizdən ötrü bu əzabdan çıxıb qurtulmağa bir yol varmı?”**

*(*Qeyd: “İki dəfə ölməkdən məqsəd - bir dəfə bu dünya həyatından əvvəl yoxluq aləmində olmaq, ikincisi təbii ölüm ilə dünyada ölmək və iki həyatdan biri həmin dünya həyatı, ikincisi qiyamət günündə yenidən dirilməkdir).*

**12) (ذٰلِكُمْ بِاَنَّهُ اِذَا دُعِيَ اللّٰهُ وَحْدَهُ كَفَرْتُمْ) - Kafirlərə cavab verilib deyilər: “Siz əbədiyyən əzab içində olacaqsınız və bunun səbəbi budur ki, o zaman ki, Allah-Təalaya dəvət edilirdiniz, ona qarşı kafir olurdunuz. (وَاِنْ يُشْرَكْ بِهِ تُؤْمِنُواۜ) Amma Allah-Təalaya şərik qoşulsaydı, ona iman edərdiniz. (فَالْحُكْمُ لِلّٰهِ الْعَلِيِّ الْكَبِيرِ) Bu günkü gündə hökm etmək şanı uca və səltənəti böyük olan Allah-Təalaya məxsusdur. Sizdən ötrü əbədi əzaba hökm edib, onun hökmünü qaytaran olmaz.**

**13) (هُوَ الَّذِي يُرِيكُمْ اٰيَاتِهِ وَيُنَزِّلُ لَكُمْ مِنَ السَّمَٓاءِ رِزْقًاۜ) - Allah-Təala öz qüdrət və tövhidinə işarə edən dəlil və sübutları siz insan nəslinə göstərir, sizdən ötrü göydən ruziyə səbəb olan yağış göndərir, lakin bunlardan heç agah olmursunuz. (وَمَا يَتَذَكَّرُ اِلَّا مَنْ يُنِيبُ) - Allah-Təalanın göstərdiyi dəlil və sübutlara şirkdən tövbə edib tövhid tərəfinə qayıdanlardan başqası agah olmaz, inadkarlar isə heç bir dəlil və sübuta inanmazlar.**

**14) (فَادْعُوا اللّٰهَ مُخْلِصِينَ لَهُ الدِّينَ وَلَوْ كَرِهَ الْكَافِرُونَ) - Ey tövbə edib, hər bir çirkin işlərdən, şirkdən Allah-Təalanın tərəfinə qayıdanlar, dininizi Allah-**

رَفِيعُ الدَّرَجَاتِ ذُو الْعَرْشِ يُلْقِي الرُّوحَ مِنْ اَمْرِهِ عَلٰى مَنْ يَشَٓاءُ مِنْ عِبَادِهِ لِيُنْذِرَ يَوْمَ التَّلَاقِ ﴿١٥﴾
يَوْمَ هُمْ بَارِزُونَ لَا يَخْفٰى عَلَى اللّٰهِ مِنْهُمْ شَيْءٌ لِمَنِ الْمُلْكُ الْيَوْمَ لِلّٰهِ الْوَاحِدِ الْقَهَّارِ ﴿١٦﴾ اَلْيَوْمَ
تُجْزٰى كُلُّ نَفْسٍ بِمَا كَسَبَتْ لَا ظُلْمَ الْيَوْمَ اِنَّ اللّٰهَ سَرِيعُ الْحِسَابِ ﴿١٧﴾ وَاَنْذِرْهُمْ يَوْمَ الْاٰزِفَةِ اِذِ
الْقُلُوبُ لَدَى الْحَنَاجِرِ كَاظِمِينَ مَا لِلظَّالِمِينَ مِنْ حَمِيمٍ وَلَا شَفِيعٍ يُطَاعُ ﴿١٨﴾

---

**Təalaya məxsus etdiyiniz halda, Ona dua edib, hər bir ehtiyacınızın həllini ondan istəyin. Hərçənd kafirlər sizin bu işinizi xoşlamasalar da, siz onlara etina etməyib öz işinizdə möhkəm olun.**

**15) (رَفِيعُ الدَّرَجَاتِ ذُو الْعَرْشِ يُلْقِي الرُّوحَ مِنْ اَمْرِهِ عَلٰى مَنْ يَشَٓاءُ مِنْ عِبَادِهِ لِيُنْذِرَ يَوْمَ التَّلَاقِ)- Allah-Təala itaət edən bəndələrinin dərəcələrini ucaldandır və cəmi məxluqata hakim olub, taxt sahibidir. Peyğəmbərlik ruhunu (qüvvəsini) öz əmr və iradəsilə öz istədiyi bəndələrinə bəxş edib, peyğəmbər seçər ki, onlar insanları qiyamət günündə Allah-Təalanın əzabı ilə qarşılaşmaqla qorxutsunlar.**

**16) (يَوْمَ هُمْ بَارِزُونَ لَا يَخْفٰى عَلَى اللّٰهِ مِنْهُمْ شَيْءٌ) - Qiyamət günü elə bir gündür ki, o gündə insanların hamısı** (qəbirlərindən) **ortaya çıxıb, heç bir şey onları gizlətməyib, özlərindən və əməllərindən də Allah-Təalaya heç bir şey məxfi qalmaz. (لِمَنِ الْمُلْكُ الْيَوْمَ) - Elə ki məhşər əhli hamısı cəm olub haqq-hesab məqamında durdular, Allah-Təala tərəfindən bir carçı onlara deyər: "Dünyanın böyüklüyü və səltənəti sizdən alındı, bugünkü gündə hakimiyyət kimdən ötrüdür və kimə məxsusdur?" Məhşər əhli cavab verib deyərlər: (لِلّٰهِ الْوَاحِدِ الْقَهَّارِ) - "Bu gündə hakimiyyət cəmi məxluqatı qəhr edən və qalib olan yeganə Allah-Təalaya məxsusdur".** (Qiyamət günündə müşriklər də müvəhhid olarlar).

**17) (اَلْيَوْمَ تُجْزٰى كُلُّ نَفْسٍ بِمَا كَسَبَتْ لَا ظُلْمَ الْيَوْمَ) - Elə ki, qiyamət günündə insanlar hakimiyyətin Allah-Təalaya məxsus olduğunu iqrar etdilər, bundan sonra onun nəticəsini bəyan edir: "Bu günkü gündə hakimiyyətin mənə məxsus olmağının nəticəsi budur ki, heç bir nəfsə zülm olunmayıb, hər bir nəfsə öz qazandığı, əməlinin qarşılığı verilər. (اِنَّ اللّٰهَ سَرِيعُ الْحِسَابِ) - Həqiqətən, Allah-Təala sürətlə haqq-hesab edəndir. Heç bir nəfsin hesabı o biri nəfsin hesabından Allah-Təalanı məşğul etməz.**

**18) (وَاَنْذِرْهُمْ يَوْمَ الْاٰزِفَةِ اِذِ الْقُلُوبُ لَدَى الْحَنَاجِرِ كَاظِمِينَ) -** (Ey Məhəmməd), **müşrik və asiləri o günlə qorxut ki, həmin gün onların cəhənnəmə daxil olması yaxındır. O zaman qorxunun şiddətindən ürəkləri ağızlarına gələr, nə oradan çıxar ki, ölsünlər və nə də yerinə qayıdar ki, nəfəs alıb, rahat olsunlar. Halbuki qəlbləri qorxu, qəm və qüssə ilə dolu olub nicat tapmağa heç bir çarə tapa bilməzlər. (مَا لِلظَّالِمِينَ مِنْ حَمِيمٍ وَلَا شَفِيعٍ يُطَاعُ) -** (Ey Məhəmməd), **elə bir**

يَعْلَمُ خَآئِنَةَ الْاَعْيُنِ وَمَا تُخْفِي الصُّدُورُ ﴿١٩﴾ وَاللّٰهُ يَقْضِي بِالْحَقِّ وَالَّذِينَ يَدْعُونَ مِنْ دُونِهِ لَا يَقْضُونَ بِشَيْءٍ اِنَّ اللّٰهَ هُوَ السَّمِيعُ الْبَصِيرُ ﴿٢٠﴾

---

**halda* zalımlardan ötrü nə yaxın olan, nə də bir mehriban dost olmaz ki, onlara kömək olsun və nə də şəfaəti qəbul olunan bir şəfaətçi olmaz ki, onlardan ötrü şəfaət edib əzabdan xilas olsunlar.**

*(*Qeyd: "Bütün xəbis sifətlərin başı olan zülmdən daha xəbisi və betəri yoxdur. Zalımlardan ötrü dünya və axirətdə nicat yoxdur. Dünyada zalımlara zülmlərinin cəzasının verilməsi ağlın vacib və təbii hökmlərindən hesab olunur və bu səbəbdən Qurani-Şərifdə həmin xəbis sifəti qadağan edən bir çox açıq-aydın ayə varid olubdur. Lakin islam ümməti Qurani-Şərifin ehkamını lazımsız bir şey kimi tərk edib, rəislərinin özlərindən ötrü düzəltdiyi qaydalara əməl etdikləri üçün zülm sifəti onların içində yayılıb, islam ölkələrinin əksəriyyətində ədalət və yardımlaşma qanunu əvəzinə zülm və yardım etməmə qaydası (xüsusən hakim əmrlərində və xüsusən Asiyanın orta qismində) islam və şəriət hökmü kimi qəbul edilibdir. Bununla belə özlərinə "qurtulmuş qrup" adını verib, özlərindən başqa millətlərin və məzhəblərin hamısını əbədi cəhənnəm atəşində hesab edirlər. Bəs belə bir millətdən ötrü nicat olarmı? Nəfsin arzusuna tabe olmaq insanın bəsirət gözünü bağlayıb, öz eybini göstərməyib, kor edər. İslam ümmətinin ixtilaf və pərişanlığının səbəbi zülm və cəfa qaydasının onların arasında zühur etməsi deyilmi? Bir halda ki Qurani-Şərifin ehkamı islam ümməti arasında rəvac tapmayıb, ona mədəniyyəti, ədaləti və insafı əmr edən ayələri gizlin qalıb, islam ümmətinin işi bundan da betər hərc-mərc olub, daha çox rəzalət və fəlakət gününə düçar olacaqdır. Dinin oruc, namaz, həcc kimi hökmlərini tərk edib başqa ümmətlərin yoluna tabe olub adlarını islamı himayə edən qoyanlar elə xəyal edirlər ki, bu yolla islamı yaya bilərlər. Əgər onlar Ramazan ayında oruc tutub, 5 vaxt namazı camaatla qılıb, həccə çox getməyin fayda və hikmətini dərk etsələr, o vaxt bilərlər ki, islam dinini yaymaq şəriətin hökmlərinə əməl etməklə olar, nəinki onu tərk etməklə. Haqqı deyin və məndən üz çevirməyin!)*

**19) (يَعْلَمُ خَآئِنَةَ الْاَعْيُنِ وَمَا تُخْفِي الصُّدُورُ) - Allah-Təalanın elmi hər bir şeyi elə əhatə edibdir ki, gözlərin xəyanət edib, halal olmayan şeylərə gizlin baxmasına və sinələrin gizlətdiyi sirlərin hamısına agahdır.**

**20) (وَاللّٰهُ يَقْضِي بِالْحَقِّ) - Bu sifətlərə sahib olan Allah-Təala xalq arasında haqq və ədalətlə hökm edər. Onun zülm etməsi təsəvvür olunmaz. (وَالَّذِينَ يَدْعُونَ مِنْ دُونِهِ لَا يَقْضُونَ بِشَيْءٍ) - Amma Allah-Təaladan başqa o bütlər ki, müşriklər onlara dua və ibadət edirlər, onlar heç bir şeyə hökm edə bilməzlər. Həyat və qüdrət sahibi olmayan şey necə hökm edə bilər? Belə şeylərə ağıllı şəxs necə ibadət edər? (اِنَّ اللّٰهَ هُوَ السَّمِيعُ الْبَصِيرُ) - Həqiqətən, Allah-Təala sizin hər bir sözünüzü eşidir və hər bir əməlinizə agahdır.**

اَوَلَمْ يَسٖيرُوا فِي الْاَرْضِ فَيَنْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الَّذٖينَ كَانُوا مِنْ قَبْلِهِمْ ۜ كَانُوا هُمْ اَشَدَّ مِنْهُمْ قُوَّةً
وَاٰثَارًا فِي الْاَرْضِ فَاَخَذَهُمُ اللّٰهُ بِذُنُوبِهِمْ وَمَا كَانَ لَهُمْ مِنَ اللّٰهِ مِنْ وَاقٍ ﴿٢١﴾ ذٰلِكَ بِاَنَّهُمْ كَانَتْ
تَأْتٖيهِمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ فَكَفَرُوا فَاَخَذَهُمُ اللّٰهُ ۜ اِنَّهُ قَوِيٌّ شَدٖيدُ الْعِقَابِ ﴿٢٢﴾ وَلَقَدْ اَرْسَلْنَا مُوسٰى
بِاٰيَاتِنَا وَسُلْطَانٍ مُبٖينٍ ۙ ﴿٢٣﴾ اِلٰى فِرْعَوْنَ وَهَامَانَ وَقَارُونَ فَقَالُوا سَاحِرٌ كَذَّابٌ ﴿٢٤﴾ فَلَمَّا جَٓاءَهُمْ
بِالْحَقِّ مِنْ عِنْدِنَا قَالُوا اقْتُلُٓوا اَبْنَٓاءَ الَّذٖينَ اٰمَنُوا مَعَهُ وَاسْتَحْيُوا نِسَٓاءَهُمْ ۜ

---

**21)** (اَوَلَمْ يَسٖيرُوا فِي الْاَرْضِ فَيَنْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الَّذٖينَ كَانُوا مِنْ قَبْلِهِمْ) - (Ey Məhəmməd), **bəs bu müşriklər yer üzünü seyr edib səfərə getmirlər ki, baxıb görsünlər, onlardan əvvəl peyğəmbərləri təkzib edənlərin sonu necə oldu?** (Və halbuki Şama və Yəmənə səfərə gedib, Ad və Səmud camaatının izlərini görüblər). **(**كَانُوا هُمْ اَشَدَّ مِنْهُمْ قُوَّةً وَاٰثَارًا فِي الْاَرْضِ**) - Onlar yer üzündə həm fiziki qüvvə və həm də möhkəm binalar və qalalar tikmək cəhətdən bu müşriklərdən üstün idilər. (**فَاَخَذَهُمُ اللّٰهُ بِذُنُوبِهِمْ وَمَا كَانَ لَهُمْ مِنَ اللّٰهِ مِنْ وَاقٍ**) - Bununla belə Allah-Təala onlara öz günahları səbəbi ilə əzab etdi. Onları Allah-Təalanın əzabından qoruyub mühafizə edən olmadı. Hamısını həlak etdi.** (Ey Məhəmməd), **gərək bu müşriklər də əzabın gəlib həlak olmalarından qorxub, şirki tərk edib müvəhhid olsunlar, yoxsa əzab ediləcəklər.**

**22) (**ذٰلِكَ بِاَنَّهُمْ كَانَتْ تَأْتٖيهِمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ فَكَفَرُوا**) - Əvvəlki ümmətlərə əzab edilməsinin səbəbi odur ki, onları peyğəmbərləri dəlil və sübutlarla bizim tərəfimizə** (tövhidə) **dəvət edirdilər, onlar qəbul etməyib kafir oldular. (**فَاَخَذَهُمُ اللّٰهُ ۜ اِنَّهُ قَوِيٌّ شَدٖيدُ الْعِقَابِ**) - Kafir olduqları üçün Allah-Təala onlara əzab edib, həlak etdi. Həqiqətən, Allah-Təala əzab etməkdə qüvvət və qüdrət sahibidir və şiddətlə əzab edəndir.** (Ey müşriklər, siz də bu peyğəmbər (Məhəmməd) gətirən Qurana kafir olmayıb, bizim əzabımızdan qorxub, ona iman edin).

**23-24) (**وَلَقَدْ اَرْسَلْنَا مُوسٰى بِاٰيَاتِنَا وَسُلْطَانٍ مُبٖينٍ ۙ اِلٰى فِرْعَوْنَ وَهَامَانَ وَقَارُونَ فَقَالُوا سَاحِرٌ كَذَّابٌ**) - (Ey Məhəmməd), o peyğəmbərlərdən biri də Musadır, həqiqətən biz Musanı onun doğruluğuna işarə edən dəlil və sübutlarımız və açıq-aşkar olan möcüzə ilə firon, Haman, Qaruna göndərdik, gedib onları bizim tərəfə dəvət etdi. Onlar qəbul etməyib dedilər: "Musa sehrbaz və yalançı bir şəxsdir."**

**25) (**فَلَمَّا جَٓاءَهُمْ بِالْحَقِّ مِنْ عِنْدِنَا**) - O zaman ki Musa bizim tərəfimizdən məsul olub haqq sözlərlə dəvət etməyə gəldi,**

**(**قَالُوا اقْتُلُٓوا اَبْنَٓاءَ الَّذٖينَ اٰمَنُوا مَعَهُ وَاسْتَحْيُوا نِسَٓاءَهُمْ**) - firon və ona tabe olanlar dedilər: "O şəxslər ki, Musa ilə birlikdə Allah-Təalaya iman ediblər, onların oğlanlarını qətl edib, qızlarını sağ qoyun ki, onlardan ötrü cəza olub, bəlkə Musadan üz çevirələr."**

وَمَا كَيْدُ الْكَافِرِينَ اِلَّا فٖي ضَلَالٍ ﴿٢٥﴾ وَقَالَ فِرْعَوْنُ ذَرُونٖيٓ اَقْتُلْ مُوسٰى وَلْيَدْعُ رَبَّهُۚ اِنّٖيٓ اَخَافُ اَنْ يُبَدِّلَ دٖينَكُمْ اَوْ اَنْ يُظْهِرَ فِي الْاَرْضِ الْفَسَادَ ﴿٢٦﴾ وَقَالَ مُوسٰى اِنّٖي عُذْتُ بِرَبّٖي وَرَبِّكُمْ مِنْ كُلِّ مُتَكَبِّرٍ لَا يُؤْمِنُ بِيَوْمِ الْحِسَابِۚ ﴿٢٧﴾وَقَالَ رَجُلٌ مُؤْمِنٌۗ مِنْ اٰلِ فِرْعَوْنَ يَكْتُمُ اٖيمَانَهُ اَتَقْتُلُونَ رَجُلًا اَنْ يَقُولَ رَبِّيَ اللّٰهُ وَقَدْ جَٓاءَكُمْ بِالْبَيِّنَاتِ مِنْ رَبِّكُمْۜ

---

(وَمَا كَيْدُ الْكَافِرِينَ اِلَّا فٖي ضَلَالٍ) - (Ey Məhəmməd), **kafirlərin məkr və hiyləsi batil olub, möminlərin oğlanlarını qətl etmək onlara bir fayda vermədi, Musanın əmri reallaşıb, iman etməyənlər zəlil oldular,** (firon Musanı qətl etməyə cəhd edirdi, ətrafında olan vəzirlər onu mane oldular, ta ki, Musanın işinin sonu onlara məlum olsun, firon onlara xitab edib deyirdi: “Musanı qətl etməkdə mənə mane olmayın, necə ki, növbəti ayədə xəbər verir).

**26)** (وَقَالَ فِرْعَوْنُ ذَرُونٖيٓ اَقْتُلْ مُوسٰى وَلْيَدْعُ رَبَّهُ) **- Firon dedi: “Ey vəzirlər, qoyun bu Musanı qətl edim, o vaxt da qoy öz rəbbini çağırsın, görüm mənə nə edəcəkdir?** (اِنّٖيٓ اَخَافُ اَنْ يُبَدِّلَ دٖينَكُمْ) **- Mən qorxuram ki, Musa sizin dininizi dəyişdirib, sizi dininizdən çıxartsın.** (اَوْ اَنْ يُظْهِرَ فِي الْاَرْضِ الْفَسَادَ) **- Ya da ki yer üzündə** (Misirdə) **fəsad törədib, qazanc və ticarətiniz kasadlaşsın. Mənə mane olmayın. İmkan verin, Musanı qətl edim, ta ki, fəsad meydana gəlməsin.**

**27)** (وَقَالَ مُوسٰى اِنّٖي عُذْتُ بِرَبّٖي وَرَبِّكُمْ مِنْ كُلِّ مُتَكَبِّرٍ لَا يُؤْمِنُ بِيَوْمِ الْحِسَابِۚ) **- Elə ki, Musa fironun onu qətl etmək istədiyi xəbərini eşitdi, üzünü fironun ətrafında olanlara tutub dedi: “Həqiqətən, hər bir təkəbbürlü və haqq-hesab gününə** (qiyamət gününə) **iman etməyən şəxslərin** (o cümlədən fironun) **şərrindən mənim və sizin rəbbiniz olan Allah-Təalaya pənah aparıram.”**

**28)** (وَقَالَ رَجُلٌ مُؤْمِنٌۗ مِنْ اٰلِ فِرْعَوْنَ يَكْتُمُ اٖيمَانَهُ) **- O vaxt fironun yaxın yoldaşlarından bir kişi* hansı ki, Musaya iman edib, imanını gizlədirdi, zahirən fironun ətrafında olanlara** (əslində isə kinayə ilə firona) **xitab edib dedi:** (اَتَقْتُلُونَ رَجُلًا اَنْ يَقُولَ رَبِّيَ اللّٰهُ وَقَدْ جَٓاءَكُمْ بِالْبَيِّنَاتِ مِنْ رَبِّكُمْ) **- Bir kişi ki, deyə mənim rəbbim yeganə olan Allah-Təaladır, halbuki rəbbiniz Allah-Təaladan özünün doğruluğuna işarə edən dəlil və sübutlarla sizə gəlib, bəs elə bir kişini qətl edib və haqq sözü dediyi üçün belə çirkin işə bulaşırsınız?**

*(*__Qeyd:__ “Bu kişi fironun əmisi oğlu idi. Cənab Musaya gizli olaraq iman etmişdi. Musaya kömək olub, bu sözü deyəndən sonra ona çox əziyyətlər etdilər. Lakin ondan da çox bizim uca peyğəmbərimizə kömək olan Əbu Bəkrə əziyyət etdilər. Allahın Rəsulu peyğəmbərliyinin əvvəlində (Əbu Bəkir ona iman edəndən sonra) gedib Kəbəni təvaf edib qurtarandan sonra müşriklər gəlib onun şalını çəkib, boynuna salıb üzünə çəkdilər. Əbu Bəkir gedib, Alla-*

وَاِنْ يَكُ كَاذِبًا فَعَلَيْهِ كَذِبُهُ ۚ وَاِنْ يَكُ صَادِقًا يُصِبْكُمْ بَعْضُ الَّذٖي يَعِدُكُمْ ۜ اِنَّ اللّٰهَ لَا يَهْدٖي مَنْ هُوَ
مُسْرِفٌ كَذَّابٌ ﴿٢٨﴾ يَا قَوْمِ لَكُمُ الْمُلْكُ الْيَوْمَ ظَاهِرٖينَ فِي الْاَرْضِۘ فَمَنْ يَنْصُرُنَا مِنْ بَاْسِ اللّٰهِ اِنْ
جَٓاءَنَاۜ قَالَ فِرْعَوْنُ مَٓا اُرٖيكُمْ اِلَّا مَٓا اَرٰى وَمَٓا اَهْدٖيكُمْ اِلَّا سَبٖيلَ الرَّشَادِ ﴿٢٩﴾وَقَالَ الَّذٖٓي اٰمَنَ يَا قَوْمِ
اِنّٖٓي اَخَافُ عَلَيْكُمْ مِثْلَ يَوْمِ الْاَحْزَابِۙ ﴿٣٠﴾

---

*hın Rəsuluna kömək edib, ağlaya-ağlaya uca səslə bu ayəni (Ə təqtulunə....) oxudu. Buna görə Əbu Bəkrə şiddətli əziyyət etdilər. İmam Cəfər Sadiq buyurubdur: "Bu ayənin məzmununu fironun qohumu olan mömin gizli şəkildə dedi, amma Əbu Bəkir açıq-aşkar dedi. Əbu Bəkir imam Cəfər Sadiqin ana tərəfdən ulu babasıdır, anası Ümmü Fərvə Qasım qızıdır. Qasım Məhəmməd oğlu, Məhəmməd Əbu Bəkir oğludur və bu səbəbdən buyurubdur: (ərəbcə ifadə) mən iki vasitə ilə Əbu Bəkrin nəslindənəm).*

**(وَاِنْ يَكُ كَاذِبًا فَعَلَيْهِ كَذِبُهُ) - Bu şəxsi ki,** (Musanı) **siz istəyirsiniz qətl edəsiniz, ya yalançıdır və ya doğru danışandır, əgər yalançı olsa, onun yalanının zərəri özünə aiddir, heç bir şəxsə ondan bir zərər gəlməyəcəkdir.** (Yalançıya öz yalanı kifayət edər), **daha onu qətl etmək lazım deyildir.**

**(وَاِنْ يَكُ صَادِقًا يُصِبْكُمْ بَعْضُ الَّذٖي يَعِدُكُمْ) - Amma əgər bu şəxs sözündə doğru isə, sizə vəd etdiyi əzabların hamısı sizə yetişməsə də, hər halda bir qismi yetişər, belə bir şəxsi qətl etmək qəbahətdir. Gərək, ona tabe olasınız. Nəinki onu inkar edib qətl etmək fikrində olasınız.**

**(اِنَّ اللّٰهَ لَا يَهْدٖي مَنْ هُوَ مُسْرِفٌ كَذَّابٌ) - Həqiqətən, Allah-Təala yalançı və həddini aşan şəxsə hidayət etməyib, onun işi sabit olmaz, bəlkə zəlil və məhv olar.** (Bu Musa da əgər yalançı isə, tezliklə zəlil və məhv olacaqdır).

**29) (يَا قَوْمِ لَكُمُ الْمُلْكُ الْيَوْمَ ظَاهِرٖينَ فِي الْاَرْضِۘ) - Ey mənim xalqım,** (həmin iman edən şəxs deyir:) **"Bu gün hakimiyyət sizindir və Misir torpağında Bəni-İsrailə qalibsiniz. Bu hakimiyyəti məhv edib, Allah-Təalanın əzabına səbəb olan işə** (Musanı qətl etməyə) **çalışmayın. (فَمَنْ يَنْصُرُنَا مِنْ بَاْسِ اللّٰهِ اِنْ جَٓاءَنَاۜ) - Əgər Allah-Təalanın əzabı bizə gəlsə, kim bizə kömək olub o əzabdan bizə nicat verər? Gəlin, Allah-Təalaya iman edib, Musaya itaət edin. (قَالَ فِرْعَوْنُ مَٓا اُرٖيكُمْ اِلَّا مَٓا اَرٰى) - Firon o mömin şəxsin sözünə etina etməyib vəzirlərə xitab edib dedi: "O rəy** (Musanı qətl etmək rəyi) **ki, sizə məsləhət etmişəm, sizin üçün ondan başqa rəy görmürəm, mənim rəyimi qəbul edib, Musanı qətl etməkdə mənə mane olmayın, bu şəxsin sözünə qulaq asmayın. (وَمَٓا اَهْدٖيكُمْ اِلَّا سَبٖيلَ الرَّشَادِ) Sizi ancaq doğru yola, sizin üçün xeyir olan yola hidayət edirəm, sizin xeyriniz Musanı qətl etməkdədir".**

**30) (وَقَالَ الَّذٖٓي اٰمَنَ يَا قَوْمِ اِنّٖٓي اَخَافُ عَلَيْكُمْ مِثْلَ يَوْمِ الْاَحْزَابِۙ) - Musaya iman edən şəxs xalqına xitab edib dedi: "Ey mənim xalqım, həqiqətən, o əvvəlki**

مِثْلَ دَاْبِ قَوْمِ نُوحٍ وَعَادٍ وَثَمُودَ وَالَّذِينَ مِنْ بَعْدِهِمْ ۜ وَمَا اللّٰهُ يُرِيدُ ظُلْمًا لِلْعِبَادِ﴿٣١﴾ وَيَا قَوْمِ اِنّ۪ٓي
اَخَافُ عَلَيْكُمْ يَوْمَ التَّنَادِۙ﴿٣٢﴾ يَوْمَ تُوَلُّونَ مُدْبِرِينَۚ مَا لَكُمْ مِنَ اللّٰهِ مِنْ عَاصِمٍۚ وَمَنْ يُضْلِلِ اللّٰهُ فَمَا
لَهُ مِنْ هَادٍ﴿٣٣﴾ وَلَقَدْ جَٓاءَكُمْ يُوسُفُ مِنْ قَبْلُ بِالْبَيِّنَاتِ فَمَا زِلْتُمْ ف۪ي شَكٍّ مِمَّا جَٓاءَكُمْ بِه۪ۜ حَتّٰٓى
اِذَا هَلَكَ قُلْتُمْ لَنْ يَبْعَثَ اللّٰهُ مِنْ بَعْدِه۪ رَسُولًاۜ كَذٰلِكَ يُضِلُّ اللّٰهُ مَنْ هُوَ مُسْرِفٌ مُرْتَابٌۚ﴿٣٤﴾ اَلَّذ۪ينَ
يُجَادِلُونَ ف۪ٓي اٰيَاتِ اللّٰهِ بِغَيْرِ سُلْطَانٍ اَتٰيهُمْ ۜ

---

**camaatlar ki, onlara peyğəmbərlər gəlib, o peyğəmbərlərə asi olduqları üçün onlara əzab edilibdir, qorxuram ki, o gün onlara edilən əzabın eynisindən sizə də əzab edilsin.**

**31) (مِثْلَ دَاْبِ قَوْمِ نُوحٍ وَعَادٍ وَثَمُودَ وَالَّذِينَ مِنْ بَعْدِهِمْ) - Ey mənim xalqım, peyğəmbərləri təkzib etmək adəti Nuh, Ad və Səmud camaatı və onlardan sonra gələn camaatlarda adət olub, onlara bu təkzib səbəbi ilə cəza verilən kimi, qorxuram ki, sizə də cəza verilsin. (وَمَا اللّٰهُ يُرِيدُ ظُلْمًا لِلْعِبَادِ) Allah-Təala öz bəndələri üçün zülm istəyən deyildir, əksinə həlak olan ümmətləri öz xəbis əməllərinə görə, ədalət üzrə həlak edibdir.**

**32) (وَيَا قَوْمِ اِنّ۪ٓي اَخَافُ عَلَيْكُمْ يَوْمَ التَّنَادِۙ) -** (Həmin mömin deyir:) **Ey mənim xalqım, həqiqətən, o gün ki, bütün məxluqat Allah-Təala tərəfindən haqq-hesabdan ötrü çağırılar, o günün əzabından qorxuram ki, o gün əzab əhlindən olasınız.**

**33) (يَوْمَ تُوَلُّونَ مُدْبِرِينَۚ مَا لَكُمْ مِنَ اللّٰهِ مِنْ عَاصِمٍۚ ) - O gün elə bir gündür ki, haqq-hesabdan qayıdıb sizi cəhənnəmə aparanda, sizi Allah-Təalanın əzabından qoruyan olmaz ki, əzabdan xilas olasınız. (وَمَنْ يُضْلِلِ اللّٰهُ فَمَا لَهُ مِنْ هَادٍ) Allah-Təala kimi öz xəbis əməli səbəbi ilə zəlalətdə saxlasa, ona hidayət edən olmaz ki, onu haqq tərəfinə hidayət edin.**

**34) (وَلَقَدْ جَٓاءَكُمْ يُوسُفُ مِنْ قَبْلُ بِالْبَيِّنَاتِ) -** (Həmin mömin deyir: "Ey mənim xalqım), **həqiqətən, bundan əvvəl** (Yaqub oğlu) **Yusif öz doğruluğuna işarə edən dəlil və sübutlarla sizə peyğəmbər gəldi.**

**(فَمَا زِلْتُمْ ف۪ي شَكٍّ مِمَّا جَٓاءَكُمْ بِه۪ۜ حَتّٰٓى اِذَا هَلَكَ قُلْتُمْ لَنْ يَبْعَثَ اللّٰهُ مِنْ بَعْدِه۪ رَسُولًاۜ ) - Amma siz Yusif gətirən hökmlərin haqqında şübhə edib, qəbul etmədiniz, amma o zaman ki, ölüm ona gəlib, ruhu alındı, o vaxt dediniz: "Allah-Təala Yusifdən sonra daha əbədiyyətə qədər peyğəmbər göndərməz və ondan sonra heç peyğəmbər olmayacaqdır." (كَذٰلِكَ يُضِلُّ اللّٰهُ مَنْ هُوَ مُسْرِفٌ مُرْتَابٌ) - Kim ki, həddini aşıb, dinin əmrlərinə şəkk etsə, Allah-Təala onu zəlalətdə saxlayar.**

**35) (اَلَّذ۪ينَ يُجَادِلُونَ ف۪ٓي اٰيَاتِ اللّٰهِ بِغَيْرِ سُلْطَانٍ اَتٰيهُمْ) - O şəxslər ki, Allah-Təalanın ayələrinin və möcüzələrinin batil olması üçün Allah-Təala tərəfindən on-**

كَبُرَ مَقْتًا عِنْدَ اللّٰهِ وَعِنْدَ الَّذٖينَ اٰمَنُواۜ كَذٰلِكَ يَطْبَعُ اللّٰهُ عَلٰى كُلِّ قَلْبِ مُتَكَبِّرٍ جَبَّارٍ ﴿٣٥﴾ وَقَالَ فِرْعَوْنُ
يَا هَامَانُ ابْنِ لٖي صَرْحًا لَعَلّٖٓي اَبْلُغُ الْاَسْبَابَۙ ﴿٣٦﴾ اَسْبَابَ السَّمٰوَاتِ فَاَطَّلِعَ اِلٰٓى اِلٰهِ مُوسٰى وَاِنّٖي
لَاَظُنُّهُ كَاذِبًاۜ وَكَذٰلِكَ زُيِّنَ لِفِرْعَوْنَ سُٓوءُ عَمَلِهٖ وَصُدَّ عَنِ السَّبٖيلِۜ وَمَا كَيْدُ فِرْعَوْنَ اِلَّا فٖي تَبَابٍ ﴿٣٧﴾
وَقَالَ الَّذٖٓي اٰمَنَ يَا قَوْمِ اتَّبِعُونِ اَهْدِكُمْ سَبٖيلَ الرَّشَادِۚ ﴿٣٨﴾ يَا قَوْمِ اِنَّمَا هٰذِهِ الْحَيٰوةُ الدُّنْيَا مَتَاعٌۘ

---

**lara dəlil və sübut gəlmədiyi halda, mücadilə edər,** (necə ki, siz edirsiniz), (كَبُرَ مَقْتًا عِنْدَ اللّٰهِ وَعِنْدَ الَّذٖينَ اٰمَنُواۜ) **- Allah və iman edənlərin yanında düşmən və çox nifrət edilən olarlar.** (كَذٰلِكَ يَطْبَعُ اللّٰهُ عَلٰى كُلِّ قَلْبِ مُتَكَبِّرٍ جَبَّارٍ) **- Hər bir zalım və təkəbbürlü şəxsin qəlbinə Allah-Təala belə möhür vurub, onları zəlalətlərində saxlayar.** (Burada həmin möminin kəlamı bitdi. Firon cənab Musanın doğru söylədiyindən qorxub, onu qətl etməkdən çəkindi).

**Lakin Musanı məğlub etmək üçün başqa səbəblər axtarmağa başladı. Necə ki, növbəti ayədə xəbər verir).**

**36)** (وَقَالَ فِرْعَوْنُ يَا هَامَانُ ابْنِ لٖي صَرْحًا لَعَلّٖٓي اَبْلُغُ الْاَسْبَابَ) **-** (Firon vəziri Hamana) **xitab edib dedi: “Ey Haman, mənim üçün bir uca qəsr** (köşk) **hazırla, bəlkə onun səbəbi ilə bəzi gizli işlərdən xəbərdar olum.”**

**37)** (اَسْبَابَ السَّمٰوَاتِ فَاَطَّلِعَ اِلٰٓى اِلٰهِ مُوسٰى وَاِنّٖي لَاَظُنُّهُ كَاذِبًاۜ) **- O səbəb göylərə yetişmək üçündür ki, o qəsrin üstünə çıxıb, göyə çatıb, Musanın məbuduna agah olum, görüm onun məndən başqa məbudu var, yoxsa yox? Çünki həqiqətən, mən onu yalançı sayıram. Əgər mən özüm onun göylərdəki məbuduna agah olsam, o vaxt onun doğruluğu mənə aydın olar.** (وَكَذٰلِكَ زُيِّنَ لِفِرْعَوْنَ سُٓوءُ عَمَلِهٖ وَصُدَّ عَنِ السَّبٖيلِ) **- Habelə şeytan fironun yaman əməlini onun üçün zinətləndirib, onu haqq yoluna tabe olmaqdan saxladı. O səbəbdən küfründə qalıb, Musanın gətirdiyi açıq-aydın ayələrə ikrahla yanaşdı.** (وَمَا كَيْدُ فِرْعَوْنَ اِلَّا فٖي تَبَابٍ) **-** (Ey Məhəmməd), **fironun məkr və hiyləsi müyəssər olmayıb, puç və məhv olub, ondan Musaya heç bir zərər gəlmədi.**

**38)** (وَقَالَ الَّذٖٓي اٰمَنَ يَا قَوْمِ اتَّبِعُونِ اَهْدِكُمْ سَبٖيلَ الرَّشَادِۚ) **-** (Həmin Musaya iman edən şəxs (fironun əmisi oğlu) xalqına nəsihət üçün xitab edib) **dedi: “Ey mənim xalqım, gəlin mənə tabe olun, sizi doğru yola hidayət edim, (bu ayədə hidayətdən müxtəsər şəkildə bəhs edilib, növbəti ayələrdə dünyanın faniliyini, axirətin əbədiliyini, xeyir əməlin mükafatını və şirkin cəzasını onlardan ötrü təfsilatlı şəkildə bəyan edir ki, hidayətin həqiqətini dərk edib, xeyrə yönəlib, şərdən çəkinsinlər.**

**39)** (يَا قَوْمِ اِنَّمَا هٰذِهِ الْحَيٰوةُ الدُّنْيَا مَتَاعٌۘ) **- Ey mənim xalqım, həqiqətən, bu dünya həyatı az sürən, lazımsız şeydir. Az bir zaman ondan fayda peyda olub, ondan sonra fani olacaqdır.**

وَاِنَّ الْاٰخِرَةَ هِيَ دَارُ الْقَرَارِ﴿٣٩﴾ مَنْ عَمِلَ سَيِّئَةً فَلَا يُجْزٰىٓ اِلَّا مِثْلَهَاۚ وَمَنْ عَمِلَ صَالِحًا مِنْ ذَكَرٍ اَوْ اُنْثٰى وَهُوَ مُؤْمِنٌ فَاُو۬لٰٓئِكَ يَدْخُلُونَ الْجَنَّةَ يُرْزَقُونَ فِيهَا بِغَيْرِ حِسَابٍ ﴿٤٠﴾ وَيَا قَوْمِ مَا لِيٓ اَدْعُوكُمْ اِلَى النَّجٰوةِ وَتَدْعُونَنِيٓ اِلَى النَّارِۜ ﴿٤١﴾ تَدْعُونَنِي لِاَكْفُرَ بِاللّٰهِ وَاُشْرِكَ بِهٖ مَا لَيْسَ لِي بِهٖ عِلْمٌۘ وَاَنَا۬ اَدْعُوكُمْ اِلَى الْعَزِيزِ الْغَفَّارِ ﴿٤٢﴾ لَا جَرَمَ اَنَّمَا تَدْعُونَنِيٓ اِلَيْهِ لَيْسَ لَهُ دَعْوَةٌ فِي الدُّنْيَا وَلَا فِي الْاٰخِرَةِ وَاَنَّ مَرَدَّنَآ اِلَى اللّٰهِ

---

(وَاِنَّ الْاٰخِرَةَ هِيَ دَارُ الْقَرَارِ) - **Həqiqətən, əsl vətən və yerləşmə yeri axirətdir. Dünyada axirət evini təmir etmək və ondan ötrü hazır olmaq lazımdır, o da peyğəmbərlərə itaət edib, Allah-Təalaya iman etməklə olar, nəinki kafir olub bütpərəst olmaqla.**

**40)** (مَنْ عَمِلَ سَيِّئَةً فَلَا يُجْزٰىٓ اِلَّا مِثْلَهَاۚ) - (Allah-Təalanın ilk sifəti ədalətdir, onun şərti isə budur:) **Kim ki, bir günah əməl etsə, Allah-Təala ona həmin günah qədər cəza verər. Çünki artıq cəza vermək zülmdür. Zülm Allah-Təalaya layiq deyildir.** (وَمَنْ عَمِلَ صَالِحًا مِنْ ذَكَرٍ اَوْ اُنْثٰى وَهُوَ مُؤْمِنٌ فَاُو۬لٰٓئِكَ يَدْخُلُونَ الْجَنَّةَ يُرْزَقُونَ فِيهَا بِغَيْرِ حِسَابٍ) - **Amma qadın və kişi kim, imanı olduğu halda, xeyir əməl etsə, onlar cənnətə daxil olub, həmin cənnətdə saysız-hesabsız ruzi onlara verilər.** (Xeyir əmələ daha çox mükafat vermək Allah-Təalanın lütfü və ehsanıdır).

**41)** (وَيَا قَوْمِ مَا لِيٓ اَدْعُوكُمْ اِلَى النَّجٰوةِ وَتَدْعُونَنِيٓ اِلَى النَّارِۜ) - **Ey mənim xalqım, mənə nə olubdur ki, mən sizi nicat tərəfinə dəvət edirəm? Amma siz məni cəhənnəm tərəfinə dəvət edirsiniz. Ağıllı şəxs nicat yolunu qoyub cəhənnəm tərəfinə gedərmi?**

**42)** (تَدْعُونَنِي لِاَكْفُرَ بِاللّٰهِ وَاُشْرِكَ بِهٖ مَا لَيْسَ لِي بِهٖ عِلْمٌ) - **Siz məni dəvət edirsiniz ki, Allah-Təalaya qarşı kafir olum və ona şərik qoşum o şeyi ki, onun şərik və məbud olması haqda mənim məlumatım yoxdur. Əgər şərik olsaydı, biz məxluqların ondan xəbərimiz olardı, şərik olmadığı üçün xəbərimiz yoxdur.** (وَاَنَا۬ اَدْعُوكُمْ اِلَى الْعَزِيزِ الْغَفَّارِ) - **Amma mən sizi müşrik və asilərə qalib olub, onlardan intiqam almağa qadir olan və tövbə edənlərin günahını bağışlayan Allah-Təalanın tərəfinə dəvət edirəm. Siz mənim dəvətimi qəbul etmirsiniz və halbuki mənim dəvətim doğru yola hidayət edir. Mən sizin dəvətinizi necə qəbul edim, hansı ki küfür və zəlalətdir?**

**43)** (لَا جَرَمَ اَنَّمَا تَدْعُونَنِيٓ اِلَيْهِ لَيْسَ لَهُ دَعْوَةٌ فِي الدُّنْيَا وَلَا فِي الْاٰخِرَةِ) - **Haqq, həqiqət budur, o bütlər ki, siz məni onların tərəfinə dəvət edirsiniz, onlar nə dünyada və nə də axirətdə xalqı özlərinə dəvət edən deyildir. Məbudun haqqı əvvəlcə xalqı özünün itaətinə dəvət etməkdir.** (Yəni gərək peyğəmbər və kitab göndərsin), **ondan sonra iman edənlər zəlalətdə olanları, gərək, o məbudun tərəfinə dəvət etsinlər. Bütlər ki, heç kimi özlərinə dəvət etmirlər, siz nədən ötrü dəvət edirsiniz?** (وَاَنَّ مَرَدَّنَآ اِلَى اللّٰهِ) - **halbuki həqiqətən də,**

وَاَنَّ الْمُسْرِفِينَ هُمْ اَصْحَابُ النَّارِ ﴿٤٣﴾ فَسَتَذْكُرُونَ مَٓا اَقُولُ لَكُمْ ۜ وَاُفَوِّضُ اَمْرِيٓ اِلَى اللّٰهِ ۜ اِنَّ
اللّٰهَ بَصِيرٌ بِالْعِبَادِ ﴿٤٤﴾ فَوَقٰيهُ اللّٰهُ سَيِّاٰتِ مَا مَكَرُوا وَحَاقَ بِاٰلِ فِرْعَوْنَ سُوٓءُ الْعَذَابِۚ ﴿٤٥﴾ اَلنَّارُ
يُعْرَضُونَ عَلَيْهَا غُدُوًّا وَعَشِيًّاۚ وَيَوْمَ تَقُومُ السَّاعَةُ ۠ اَدْخِلُوٓا اٰلَ فِرْعَوْنَ اَشَدَّ الْعَذَابِ ﴿٤٦﴾ وَاِذْ
يَتَحَٓاجُّونَ فِي النَّارِ فَيَقُولُ الضُّعَفٰٓؤُا لِلَّذِينَ اسْتَكْبَرُوٓا اِنَّا كُنَّا لَكُمْ تَبَعًا فَهَلْ اَنْتُمْ مُغْنُونَ عَنَّا نَصِيبًا
مِنَ النَّارِ ﴿٤٧﴾

---

**bizim axır dönüşümüz olan yeganə Allah-Təala tərəfindən hər bir şəxsin öz əməlinə görə ona cəza veriləcəkdir.** (وَاَنَّ الْمُسْرِفِينَ هُمْ اَصْحَابُ النَّارِ) **- Hədlərini aşıb, Allah-Təalaya asi olub şərik qoşanlar cəhənnəm yoldaşlarıdır, həmişə cəhənnəmdə olacaqlar.**

**44) (فَسَتَذْكُرُونَ مَٓا اَقُولُ لَكُمْ) - Bir vaxt gələr ki,** (sizə əzab gələn vaxt) **mənim sözlərimi və nəsihətlərimi xatırlayıb peşman olarsınız, amma o vaxt peşmançılıq sizə fayda verməz. (وَاُفَوِّضُ اَمْرِيٓ اِلَى اللّٰهِ ۜ اِنَّ اللّٰهَ بَصِيرٌ بِالْعِبَادِ) - Siz məni qorxudursunuz, mənim sizdən qorxum yoxdur. Hər bir işimi Allah-Təalaya həvalə etmişəm. Həqiqətən, Allah-Təala öz bəndələrini görür və onların haqq və batil işlərindən agahdır.”** (Burada həmin möminin sözü bitdi, növbəti ayədə Allah-Təala həmin möminin nicatı xüsusunda buyurur).

**45) (فَوَقٰيهُ اللّٰهُ سَيِّاٰتِ مَا مَكَرُوا) -** (Ey Məhəmməd), **Allah-Təala o mömini kafirlərin ondan ötrü qurduğu məkr və hiylənin şərindən mühafizə edib qorudu. Ona heç bir əziyyət edə bilmədilər. (وَحَاقَ بِاٰلِ فِرْعَوْنَ سُوٓءُ الْعَذَابِ) - Amma fironun özünü və ona tabe olanları yaman əzab** (dənizdə qərq olmaq, axirətdə cəhənnəm əzabı) **əhatə edib tutdu. Hamısı həlak oldular.**

**46) (اَلنَّارُ يُعْرَضُونَ عَلَيْهَا غُدُوًّا وَعَشِيًّا) - Fironun özünü və ona tabe olanları səhər-axşam** (qiyamətə qədər) **oda salıb əzab edərlər.**

**(وَيَوْمَ تَقُومُ السَّاعَةُ ۠ اَدْخِلُوٓا اٰلَ فِرْعَوْنَ اَشَدَّ الْعَذَابِ) - Elə ki qiyamət günü oldu, o gündə Allah-Təala tərəfindən cəhənnəm mühafizlərinə əmr olunar: “Fironun özünü və ona tabe olanları şiddətli əzaba daxil edin.**

**47) (وَاِذْ يَتَحَٓاجُّونَ فِي النَّارِ) -** (Ey Məhəmməd), **o zaman ki cəhənnəm əhli olan asilər** (o cümlədən firon və ona tabe olanlar) **cəhənnəmə daxil oldular, həmin odun içində əzab halətində bir-biriləri ilə dalaşıb, mübahisə edərlər. (فَيَقُولُ الضُّعَفٰٓؤُا لِلَّذِينَ اسْتَكْبَرُوٓا اِنَّا كُنَّا لَكُمْ تَبَعًا فَهَلْ اَنْتُمْ مُغْنُونَ عَنَّا نَصِيبًا مِنَ النَّارِ) - Zəiflər* dünyada hakimiyyət sürən böyüklərinə xitab edib deyərlər: “Həqiqətən, biz sizə dünyada tabe olub sizi özümüzə ağa və rəis seçmişdik, amma bilmədik ki, siz bizdən betər şərir və fasiq imişsiniz, sizi təqva libasında görüb sizə etimad etdik. İndi o xidmətin əvəzində, bəlkə, bu gün od əzabını bizdən bir qədər dəf edəsiniz ki, əzabımız yüngülləşsin”.**

قَالَ الَّذِينَ اسْتَكْبَرُوٓا اِنَّا كُلٌّ فِيهَآ اِنَّ اللّٰهَ قَدْ حَكَمَ بَيْنَ الْعِبَادِ ﴿٤٨﴾ وَقَالَ الَّذِينَ فِي النَّارِ لِخَزَنَةِ جَهَنَّمَ ادْعُوا رَبَّكُمْ يُخَفِّفْ عَنَّا يَوْمًا مِنَ الْعَذَابِ ﴿٤٩﴾

---

*(*Qeyd: "Allah-Təala bu ayədə dünyada adlarını din və millət rəisi qoyub, Allah-Təalanın kitabının ziddini xalqa verib, onları aldadıb, özlərinə tabe edənlərlə, onlara tabe olanların cəhənnəmdəki sual-cavablarını xəbər verir. ki, islam ümməti agah olub, adlarını rəis qoyub Quranın ziddini deyən şəxslərin sözlərinə qulaq asmayıb, qoyun qurddan qaçan kimi gərək onlardan qaçsınlar. Lakin islam ümməti cəhalətə elə düçar olub ki, nə Qurani-Şərifdən, nə də islamdan heç bir şeyə agah deyil. Bəzi hiyləgər rəislər öz şəxsi faydalarından ötrü avam camaatı cəhalətdə saxlayıb, islamdan heç bir şeyə agah olmamalarını münasib görüblər. Bəziləri də özləri həqiqətən avam olub Qurani-Şərif və islamdan heç bir şey anlamayıblar. Əgər islam ümməti Qurani-Şərifin ehkamına agah olsaydılar, onların arasında bu qədər ixtilaf zühur etməzdi. Çünki Qurani-Şərifin ehkamları bir-biri ilə müxalif və zidd deyildir, bu ixtilaflar uydurma sözlərdən yaranıbdır. Hədislər arasında uydurma olanlar həddən çox olduğuna görə islam ümməti arasında bu ixtilaflar meydana gəldi. Saf olan Qurana müxalif olan kəlamlara əməl etmək islamı bu fəlakət və rəzalət gününə saldı. Əgər islam ümməti bəsirət gözlərini və qəlb qulaqlarını dürüst açıb Qurani-Şərifin ehkamını dərk etsə, o vaxt bizim istifadə etdiyimiz ehkamların Qurana müxalif olmağı onlara aydın olar. Bir kitab, bir peyğəmbər, bir qiblə, bir dinə tabe olan islam ümməti bu gündə neçə qrup olub, hər biri bir adla adlanıb və hər qrup özünü qurtulmuş qrup sayıb, digər qrupları zəlil və məhv olmuş adlandırırlar. Bunlar hamısı Qurani-Şərifin ehkamını unutmaqdan, ya da ki, Quranın mənasını dərk etməməkdən meydana gəlibdir. Belə camaatdan ötrü nicat, ya da bir ümid yeri varmı? Savab yoluna hidayət edən Allahdır).*

**48) (قَالَ الَّذِينَ اسْتَكْبَرُوٓا اِنَّا كُلٌّ فِيهَآ) - Rəislər özlərinə tabe olanlara cavab verib deyərlər: "Həqiqətən, biz və siz, hamımız bu cəhənnəm odunda olub hamımıza əzab olunur, necə olar ki, sizdən əzabı dəf edək, əgər mümkün olsa, özümüzdən dəf edərik. Siz də dünyada öz ixtiyarınızla bizə tabe oldunuz. Biz dünya işlərimizdən ötrü hiylə edib sizi aldatdıq, siz özünüz axmaq idiniz, aldanmayaydınız, indi bizdən sizə heç bir fayda olmaz. (اِنَّ اللّٰهَ قَدْ حَكَمَ بَيْنَ الْعِبَادِ) Həqiqətən, Allah-Təala öz bəndələrinin arasında hökm edib, behişt əhli behiştə, cəhənnəm əhli cəhənnəmə daxil olublar. Daha bizdən ötrü nicat olmayacaqdır.**

**49) (وَقَالَ الَّذِينَ فِي النَّارِ لِخَزَنَةِ جَهَنَّمَ ادْعُوا رَبَّكُمْ يُخَفِّفْ عَنَّا يَوْمًا مِنَ الْعَذَابِ) -** (Ey Məhəmməd), **elə ki, cəhənnəm əhli bir-birlərindən kömək istəməkdən ümidsiz oldular, cəhənnəm mühafizlərindən yardım istəyib, onlara xitab edib de-**

قَالُوٓا اَوَلَمْ تَكُ تَأْتِيكُمْ رُسُلُكُمْ بِالْبَيِّنَاتِۜ قَالُوا بَلٰىۜ قَالُوا فَادْعُواۚ وَمَا دُعٰٓؤُا الْكَافِرِينَ اِلَّا فٖي ضَلَالٍ۟
﴿٥٠﴾ اِنَّا لَنَنْصُرُ رُسُلَنَا وَالَّذٖينَ اٰمَنُوا فِي الْحَيٰوةِ الدُّنْيَا وَيَوْمَ يَقُومُ الْاَشْهَادُۙ ﴿٥١﴾ يَوْمَ لَا يَنْفَعُ
الظَّالِمٖينَ مَعْذِرَتُهُمْ وَلَهُمُ اللَّعْنَةُ وَلَهُمْ سُٓوءُ الدَّارِ ﴿٥٢﴾

---

**yərlər: “Bizə rəhm edib, rəbbiniz Allah-Təalaya dua edin, bircə gün bizdən əzabı yüngülləşdirsin ki, bircə gün rahat olaq.**

**50) (قَالُوٓا اَوَلَمْ تَكُ تَأْتِيكُمْ رُسُلُكُمْ بِالْبَيِّنَاتِۜ) - Cəhənnəm mühafizləri onların cavabında deyərlər:* “Bəs sizin peyğəmbərləriniz dəlil və sübutlarla gəlib, sizi haqq tərəfinə dəvət etmədilərmi?” (قَالُوا بَلٰىۜ) - Cəhənnəm əhli deyər: “Bəli, gəldilər və haqq tərəfinə bizi dəvət etdilər. Lakin biz qəbul etmədik. (قَالُوا فَادْعُواۚ وَمَا دُعٰٓؤُا الْكَافِرِينَ اِلَّا فٖي ضَلَالٍ) - Cəhənnəm mühafizləri deyərlər: “Bizdə o cürət və cəsarət yoxdur ki, Allah-Təalanı çağırıb sizdən ötrü dua edək, siz özünüz dua edin, amma bunu da bilin ki, sizin kimi kafirlərin duası batildir və qəbul olunan deyildir.**

*(*Qeyd: Şəriət sahibi olan peyğəmbərlər Allah-Təala tərəfindən kitab gətirib, onu xalqdan ötrü ehkam təyin edib, özləri Allah-Təala tərəfinə gediblər. Elə ki, şəriət sahibi olan peyğəmbər Allah-Təala tərəfindən kitab gətirib, xalqı o kitaba itaət etməyə dəvət etdi. O peyğəmbər özü ola, ya olmaya, xalqa bu sözün deyilməsi doğrudur: “Bəs Allahu Təala tərəfindən peyğəmbər gəlib sizi onun tərəfinə dəvət etmədimi? Çünki təbliğ edən peyğəmbər gedib, əsl peyğəmbər olan Qurani-Şərif hər an və hər dəqiqə xalqı haqq tərəfinə dəvət edib, günəş kimi doğru olan yola işarə edən bir kitabdır, lakin xalqın gözünü cəhalət pərdəsi tutduğu üçün elə nurdan qafil olub, özlərini peyğəmbərsiz hesab edib, bəziləri cəhalətin çoxluğundan təzə dəvətçilər istəyirlər. Necə ki, bizim islam ümmətinin bəzi camaatları bu dərdə düçar olublar və bu səbəbdən onların arasında hər zaman xüsusi adı olan, ya da Mehdi adı ilə bir yeni dəvətçi meydana gəlir, nadanlıq insanı böyük fəlakətlərə düçar edir. Allah qullarının nə etdiyini yaxşı görür).*

**51) (اِنَّا لَنَنْصُرُ رُسُلَنَا وَالَّذٖينَ اٰمَنُوا فِي الْحَيٰوةِ الدُّنْيَا وَيَوْمَ يَقُومُ الْاَشْهَادُ) -** (Ey Məhəmməd), **həqiqətən, biz öz peyğəmbərlərimizə və bizə iman edən müvəhhidlərə həm dünya həyatında, həm də peyğəmbərlərin doğruluğuna şahidlərin olduğu gündə** (qiyamət günündə) **kömək edərik. Peyğəmbərlərimiz həm dünyada müşriklərə qalib olub, onları zəlil ediblər, həm də axirətdə müşriklər üzr istəyib, peyğəmbərlərin doğruluğuna şəhadət verib, peyğəmbərlər yenə onlara qalib olarlar.**

**52) (يَوْمَ لَا يَنْفَعُ الظَّالِمٖينَ مَعْذِرَتُهُمْ وَلَهُمُ اللَّعْنَةُ وَلَهُمْ سُٓوءُ الدَّارِ) - Allah-Təala peyğəmbərlərinə o gün kömək edər ki, o gündə zalımlara üzr istəmələri fayda**

وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْهُدٰى وَاَوْرَثْنَا بَنِيٓ اِسْرَآءِيلَ الْكِتَابَۙ ﴿٥٣﴾ هُدًى وَذِكْرٰى لِاُو۬لِي الْاَلْبَابِ
﴿٥٤﴾ فَاصْبِرْ اِنَّ وَعْدَ اللّٰهِ حَقٌّ وَاسْتَغْفِرْ لِذَنْبِكَ وَسَبِّحْ بِحَمْدِ رَبِّكَ بِالْعَشِيِّ وَالْاِبْكَارِ ﴿٥٥﴾ اِنَّ
الَّذِينَ يُجَادِلُونَ فِيٓ اٰيَاتِ اللّٰهِ بِغَيْرِ سُلْطَانٍ اَتٰيهُمْۙ اِنْ فِي صُدُورِهِمْ اِلَّا كِبْرٌ مَا هُمْ بِبَالِغِيهِۚ فَاسْتَعِذْ
بِاللّٰهِۜ اِنَّهُ هُوَ السَّم۪يعُ الْبَص۪يرُ ﴿٥٦﴾ لَخَلْقُ السَّمٰوَاتِ وَالْاَرْضِ اَكْبَرُ مِنْ خَلْقِ النَّاسِ

---

**verməz və onlardan ötrü Allah-Təalanın rəhmətindən uzaq olmaq və yenə onlardan ötrü axirətdə yaman ev** (cəhənnəm) **vardır.**

**53-54) (وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْهُدٰى وَاَوْرَثْنَا بَنِيٓ اِسْرَآءِيلَ الْكِتَابَ) -** (Ey Məhəmməd), **həqiqətən biz Musaya haqq tərəfinə hidayət etmək yolunu təlim etməyi lütf etdik və özündən sonra Bəni-İsrailə kitabı (tövhidi) miras qoyub onların arasında dəvət edən təyin etdik. (هُدًى وَذِكْرٰى لِاُو۬لِي الْاَلْبَابِ) - Tövrat ağıl sahiblərindən ötrü hidayət və agah olub haqqı dərk etmək üçün dəlildir.**

**55) (فَاصْبِرْ اِنَّ وَعْدَ اللّٰهِ حَقٌّ) -** (Ey Məhəmməd), **biz sənə Musanın hekayəsini nəql etdik, xəbərdar oldun ki, axırda biz Musanı düşmənə qalib etdik. Sən də səbir et. Allah-Təala sənə qələbə vədi verir və həqiqətən də, Allah-Təalanın vədi haqdır. Əlbəttə, vaqe olacaqdır.**

**(وَاسْتَغْفِرْ لِذَنْبِكَ وَسَبِّحْ بِحَمْدِ رَبِّكَ بِالْعَشِيِّ وَالْاِبْكَارِ) - Həmişə təqva içində olub, bəzi ifrat əməllərindən üzrxahlıq edib, səhər-axşam rəbbin Allah-Təalaya həmd-səna edib, hər bir eyib və nöqsandan onu pak, müqəddəs say.**

**56) (اِنَّ الَّذِينَ يُجَادِلُونَ فِيٓ اٰيَاتِ اللّٰهِ بِغَيْرِ سُلْطَانٍ اَتٰيهُمْ) -** (Ey Məhəmməd). **həqiqətən, o şəxslər ki, Allah-Təaladan onlara gəlməyən dəlil və sübutla, öz xəyalları ilə quraşdırdıqları dəlillərlə Allah-Təalanın ayələri haqqında mübahisə edirlər, (اِنْ فِي صُدُورِهِمْ اِلَّا كِبْرٌ) - onların qəlblərindəki təkəbbür, qürur, böyüklük iddiasından istəyirlər özləri rəis olsunlar. O səbəbdən səni düşmən sayıb. tabe olmurlar. (مَا هُمْ بِبَالِغِيهِ) -** (Ey Məhəmməd), **müşriklər istədiklərinə çatmayacaqlar. Əksinə, hamısı sənin əlində zəlil və məğlub olacaqdır. (فَاسْتَعِذْ بِاللّٰهِۜ اِنَّهُ هُوَ السَّم۪يعُ الْبَص۪يرُ) -** (Ey Məhəmməd), **sənə qarşı təkəbbürlənib, sənə qarşı ikrah edənlərdən Allah-Təalaya pənah apar, həqiqətən, Allah-Təala sənin sözünü və müşriklərin sözlərini eşidib, sizin əməllərinizdən agahdır.**

**57) (لَخَلْقُ السَّمٰوَاتِ وَالْاَرْضِ اَكْبَرُ مِنْ خَلْقِ النَّاسِ) -** (Ey Məhəmməd), **bu müşriklər ki qiyaməti inkar edirlər, bəs göylərə və yerə baxmırlar ki, onların yaradılması insanın yaradılmasından daha böyük və təəccüblüdür? Göyün və yerin yaradılmasına Allah-Təala qadir oldu, insanın yaradılmasına da qadir olar, onların nəzərində insan bir cüzi və zəif* şeydir, amma yeri və göyləri çox əzəmətli hesab edirlər. Bəs nə səbəbdən Allah-Təalanın insanı yenidən yaradacağına inanmırlar?**

وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ﴿٥٧﴾ وَمَا يَسْتَوِي الْاَعْمٰى وَالْبَصِيرُ وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ
وَلَا الْمُسٖٓيءُ ۜ قَلٖيلًا مَا تَتَذَكَّرُونَ ﴿٥٨﴾ اِنَّ السَّاعَةَ لَاٰتِيَةٌ لَا رَيْبَ فٖيهَا وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا
يُؤْمِنُونَ﴿٥٩﴾ وَقَالَ رَبُّكُمُ ادْعُونٖٓي اَسْتَجِبْ لَكُمْ ۜ اِنَّ الَّذٖينَ يَسْتَكْبِرُونَ عَنْ عِبَادَتٖي سَيَدْخُلُونَ
جَهَنَّمَ دَاخِرٖينَ ۟﴿٦٠﴾

---

*(***Qeyd:** "O biçarələr naqis ağılları ilə insanı zəif bir şey sayıb yeri və göyləri əzəmətinə görə böyük və heyrətli hesab edirdilər. Lakin insanın həqiqətindən, göylərin və yerin insan üçün yaradılmasından qafil olublar. İnsana əmanət edilən elm və hünər o zaman müşriklər arasında yayılmamışdı, elm sahibi şəxsə də qədir-qiymət qoymurdular. Əgər qədir-qiymət qoysaydılar, uca peyğəmbərə tabe olub, ondan əlahiddə möcüzələr xahiş etməzdilər və bu səbəbdən insanın vücudu onların nəzərində həqir və dəyərsiz görünürdü. Allah-Təalanın insanlardan daha fəzilətli vəkili, məxluqu olmadığına görə onların haqqında Qurani-Şərifdə "Adəm nəslinə şərəf verdik" ayəsini buyurub, Qurani-Şərif də dünya var olduqca oxunacaqdır. Zamanın dövranı ilə insanlardan meydana gələn fəzilət və kamillik insanın ən fəzilətli məxluq olmasına açıq-aşkar dəlil və qəti sübutdur).*

(وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ) **- Lakin insanların əksəriyyəti diqqətlə təfəkkür etmədiyi üçün Allah-Təalanın qüdrətindən agah deyil.**

**58)** (وَمَا يَسْتَوِي الْاَعْمٰى وَالْبَصِيرُ وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ وَلَا الْمُسٖٓيءُ) **- Ey Məhəmməd, gözü kor olan şəxslə görən, iman edib, xeyir əməl edənlə günahkar bərabər olmazlar.** (قَلٖيلًا مَا تَتَذَكَّرُونَ ) **- Lakin çox az olur ki, siz insan nəsli agah olub bu qeyd olunanların arasına fərq qoyasınız. Əgər fərq qoysaydınız, şirki tövhidə, küfrü imana üstün saymayıb, Qurani-Şərifə tabe olardınız.**

**59)** (اِنَّ السَّاعَةَ لَاٰتِيَةٌ لَا رَيْبَ فٖيهَا) **-** (Ey Məhəmməd), **həqiqətən, əlbəttə qiyamət gəlib, yetişib vaqe olacaqdır. Onun vaqe olacağına şəkk etmək layiq deyildir.** (وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يُؤْمِنُونَ)**- Lakin xalqın əksəriyyəti qiyamətin vaqe olacağına iman edən deyildir.**

**60)** (وَقَالَ رَبُّكُمُ ادْعُونٖٓي اَسْتَجِبْ لَكُمْ) **-** (Ey Məhəmməd), **xalqa de ki, sizin rəbbiniz Allah-Təala buyurur: "Ey mənim bəndələrim, mənə ibadət edin və bir ehtiyac məqamında mənə dua edin ki, sizin duanızı qəbul edib, hər bir ehtiyacınızı həll edim.** (اِنَّ الَّذٖينَ يَسْتَكْبِرُونَ عَنْ عِبَادَتٖي سَيَدْخُلُونَ جَهَنَّمَ دَاخِرٖينَ) **- Həqiqətən, o şəxslər ki mənə ibadət və bəndəlik etməyib, təkəbbürlənir əlbəttə onlar zəlil olduqları halda cəhənnəmə daxil olacaqlar."**

اَللّٰهُ الَّذ۪ي جَعَلَ لَكُمُ الَّيْلَ لِتَسْكُنُوا ف۪يهِ وَالنَّهَارَ مُبْصِرًاۜ اِنَّ اللّٰهَ لَذُو فَضْلٍ عَلَى النَّاسِ وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ
لَا يَشْكُرُونَ ﴿٦١﴾ذٰلِكُمُ اللّٰهُ رَبُّكُمْ خَالِقُ كُلِّ شَيْءٍۢ لَٓا اِلٰهَ اِلَّا هُوَۘ فَاَنّٰى تُؤْفَكُونَ ﴿٦٢﴾ كَذٰلِكَ
يُؤْفَكُ الَّذ۪ينَ كَانُوا بِاٰيَاتِ اللّٰهِ يَجْحَدُونَ ﴿٦٣﴾ اَللّٰهُ الَّذ۪ي جَعَلَ لَكُمُ الْاَرْضَ قَرَارًا وَالسَّمَٓاءَ بِنَٓاءً

---

**61) (اَللّٰهُ الَّذ۪ي جَعَلَ لَكُمُ الَّيْلَ لِتَسْكُنُوا ف۪يهِ وَالنَّهَارَ مُبْصِرًاۜ) - Allah-Təala öz kamil qüdrəti ilə sizdən ötrü gecəni təyin etdi ki, gecədə sakit olub rahat olasınız və gündüzü təyin etdi ki, hər bir şeyi dərk edib məişət işlərinizdə bəsirət sahibi olasınız. (اِنَّ اللّٰهَ لَذُو فَضْلٍ عَلَى النَّاسِ وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَشْكُرُونَ) - Həqiqətən, Allah-Təala insan nəslinə qarşı mərhəmət sahibidir. Onlardan ötrü məişət işlərində səbəbləri mövcud edibdir. Lakin insanların əksəriyyəti Allah-Təalaya şükür etmirlər.**

**62) (ذٰلِكُمُ اللّٰهُ رَبُّكُمْ خَالِقُ كُلِّ شَيْءٍۢ لَٓا اِلٰهَ اِلَّا هُوَ) - Ey insan nəsli, belə qüdrət sahibi olan sizin rəbbiniz Allah-Təala hər bir şeyin yaradıcısıdır və ondan başqa haqq məbud yoxdur. (فَاَنّٰى تُؤْفَكُونَ) - Bəs nəyə görə onun ibadətindən dönüb, bütlərə ibadət edib, onları özünüzə məbud seçirsiniz?**

**63) (كَذٰلِكَ يُؤْفَكُ الَّذ۪ينَ كَانُوا بِاٰيَاتِ اللّٰهِ يَجْحَدُونَ) -** (Ey Məhəmməd), **bu müşriklərdən əvvəlki o şəxslər ki, Allah-Təalanın ayələrini inkar edirdilər, onlar da bu müşriklər kimi bütlərə sitayiş edib, bütləri özlərinə məbud seçirdilər.** (Necə ki onlar öz cəzalarına yetişdilər, bu müşriklər də öz cəzalarına yetişəcəklər).

**64) (اَللّٰهُ الَّذ۪ي جَعَلَ لَكُمُ الْاَرْضَ قَرَارًا وَالسَّمَٓاءَ بِنَٓاءً ) - Allah-Təala öz kamil qüdrəti ilə siz insan nəslindən ötrü yeri məskən təyin etdi ki, yer üzündə məskən salıb, faydalanasınız və sizdən ötrü səmanı*** (havanı) **qübbə kimi təyin etdi ki, hər bir tərəfdən sizə əhatə edib, sizin üçün həyat və məişət səbəbi olsun.**

*(*Qeyd: "Hər bir ruh sahibinin həyatının ən böyük istinadgahı hava olduğuna görə Allah-Təala ayədə şükür etməmiz üçün bizdən ötrü havanı yad edib və bizim həyatımız üçün onun vacibliyini son dərəcə dəqiq rəmz və incəlik ilə bəyan edir. Yəni siz insan nəsli, gərək, havanın həyatın ən böyük təməli, hətta əsl həqiqəti olduğunu dərk edib anlayasınız ki, onun dəyişməsinə, kirliliyinə və təmizliyinə bais olan işlərin təhqiqinə cəhd edib və bu təməl istinadgahın dəyişərək insanın həyatına zərər verməsindən gərək onu mühafizə edəsiniz. Bu ayənin bir kəlməsində belə böyük bir mənanın ehtiva olunmasından bizim islam ümməti necə qafil olubdur? Onlara deyəndə ki, iy verən, çürümüş şeylərdən çəkinin ki, nəfəs aldığınız hava iylənməsin, çünki hava iy verən vaxt ondan öldürücü xəstəliklər meydana gəlib, əcəli gəlməmiş insanların həyatını məhv edər. Belə vaxtda bu sözlərdən təəccüb edib, bunu deyənə*

وَصَوَّرَكُمْ فَاَحْسَنَ صُوَرَكُمْ وَرَزَقَكُمْ مِنَ الطَّيِّبَاتِ ذٰلِكُمُ اللّٰهُ رَبُّكُمْ فَتَبَارَكَ اللّٰهُ رَبُّ الْعَالَمِينَ
﴿٦٤﴾ هُوَ الْحَيُّ لَآ اِلٰهَ اِلَّا هُوَ فَادْعُوهُ مُخْلِصِينَ لَهُ الدِّينَ اَلْحَمْدُ لِلّٰهِ رَبِّ الْعَالَمِينَ ﴿٦٥﴾
قُلْ اِنّي نُهِيتُ اَنْ اَعْبُدَ الَّذِينَ تَدْعُونَ مِنْ دُونِ اللّٰهِ لَمَّا جَآءَنِيَ الْبَيِّنَاتُ مِنْ رَبّي وَاُمِرْتُ اَنْ اُسْلِمَ
لِرَبِّ الْعَالَمِينَ ﴿٦٦﴾

---

*səfehlik və axmaqlıq isnad edirlər. Təvəkkülün mənasını dərk etməmiş, - hər bir işimizdə Allah-Təalaya təvəkkül etmişik deyib, belə mərhəmətli nəsihətçini rədd edirlər. Bəli, Qurani-Şərifin incəlik və rəmzlərindən qafil olmaq islam ümmətini cəhalət və nadanlığa düçar edibdir. Adlarını din və ümmət rəisi qoyanların əksəriyyətindən göyün həqiqətini soruşanda, göylərin biri yaqut, biri "zəbərcəd" (qiymətli yaşıl daş), biri zümrüd və başqa-başqadır, bundan başqasına etiqad edənləri təkfir etmək lazımdır deyib, özləri hər bir elmdən uzaq olduğu kimi avam camaata da sual verməyi qadağan edirlər. İslam ümmətini fəlakətə salıb, onları cəhalətə vadar edənlərə Allah-Təala bəla verib, onları islam ümmətinin arasından yox etsin. Amin!)*

**(وَصَوَّرَكُمْ فَاَحْسَنَ صُوَرَكُمْ) - Allah-Təala sizə insan surətini bəxş edib, ən gözəl surətdə yaratdı. (وَرَزَقَكُمْ مِنَ الطَّيِّبَاتِ) - Təbiəti etibarilə əvvəldən çəkinmədiyiniz pakizə ruzilərdən sizə ruzi verdi.** (Bu ayə təbiəti etibarilə əvvəldən çəkindiyiniz yeyəcəklərin haram olmasına açıq-aşkar işarə edir). **(ذٰلِكُمُ اللّٰهُ رَبُّكُمْ فَتَبَارَكَ اللّٰهُ رَبُّ الْعَالَمِينَ)** - (Ey Məhəmməd), **sizin rəbbiniz belə sifətlər sahibi olan Allah-Təaladır. Aləmlərin rəbbi, tərbiyə edicisi olan Allah-Təala son dərəcə xeyirli və bərəkətlidir.**

**65) (هُوَ الْحَيُّ لَآ اِلٰهَ اِلَّا هُوَ فَادْعُوهُ مُخْلِصِينَ لَهُ الدِّينَ) - Elə bir kamil həyat sahibidir ki, onun vücuduna fanilik və puçluq yol tapmaz, müqəddəs yaradıcı və alimdir. Ondan başqa haqq məbud yoxdur. Din və imanınızı elə yeganə Allah-Təalaya məxsus etdiyiniz halda ona dua və ibadət edin. (اَلْحَمْدُ لِلّٰهِ رَبِّ الْعَالَمِينَ) - Deyin: "Aləmlərin rəbbi və tərbiyə verəni yeganə Allah-Təalaya həmd olsun."**

**66) (قُلْ اِنّي نُهِيتُ اَنْ اَعْبُدَ الَّذِينَ تَدْعُونَ مِنْ دُونِ اللّٰهِ لَمَّا جَآءَنِيَ الْبَيِّنَاتُ مِنْ رَبّي)** - (Ey Məhəmməd), **de ki, o zaman ki, mənim rəbbim Allah-Təaladan mənə dəlil və sübutlar gəlib,** (məndə olan ağıl dəlilinə kömək oldu, bir tərəfdən ağıl dəlili, digər tərəfdən Allah-Təalanın Qurani-Şərifdə göndərdiyi dəlillər) **sizi Allah-Təaladan başqa ibadət etdiyiniz bütlərə mənim ibadət etməmi qadağan etdi. Belə bir halda mən o bütlərə necə ibadət edim?**

**(وَاُمِرْتُ اَنْ اُسْلِمَ لِرَبِّ الْعَالَمِينَ) - Əmr olunmuşam ki, (ağıl dəlili mənə əmr edibdir) işimi aləmlərin rəbbi, tərbiyə verəni olan Allah-Təalaya həvalə edib, ona itaət edim.**

هُوَ الَّذِي خَلَقَكُمْ مِنْ تُرَابٍ ثُمَّ مِنْ نُطْفَةٍ ثُمَّ مِنْ عَلَقَةٍ ثُمَّ يُخْرِجُكُمْ طِفْلًا ثُمَّ لِتَبْلُغُوٓا اَشُدَّكُمْ ثُمَّ
لِتَكُونُوا شُيُوخًاۚ وَمِنْكُمْ مَنْ يُتَوَفّٰى مِنْ قَبْلُ وَلِتَبْلُغُوٓا اَجَلًا مُسَمًّى وَلَعَلَّكُمْ تَعْقِلُونَ ﴿٦٧﴾ هُوَ
الَّذ۪ي يُحْي۪ وَيُم۪يتُۚ فَاِذَا قَضٰٓى اَمْرًا فَاِنَّمَا يَقُولُ لَهُ كُنْ فَيَكُونُ ﴿٦٨﴾ اَلَمْ تَرَ اِلَى الَّذ۪ينَ يُجَادِلُونَ
ف۪ٓي اٰيَاتِ اللّٰهِۜ اَنّٰى يُصْرَفُونَ ﴿٦٩﴾ اَلَّذ۪ينَ كَذَّبُوا بِالْكِتَابِ وَبِمَٓا اَرْسَلْنَا بِه۪ رُسُلَنَاۜ فَسَوْفَ يَعْلَمُونَ
﴿٧٠﴾ اِذِ الْاَغْلَالُ ف۪ٓي اَعْنَاقِهِمْ وَالسَّلَاسِلُۜ يُسْحَبُونَ ﴿٧١﴾ فِي الْحَم۪يمِ

---

**67) (هُوَ الَّذ۪ي خَلَقَكُمْ مِنْ تُرَابٍ) - Allah-Təala öz kamil qüdrəti ilə sizin əslinizi** (atanız, ananız Adəm və Həvvanı) **torpaqdan yaratdı. (ثُمَّ مِنْ نُطْفَةٍ) Elə ki Adəmlə Həvvanı torpaqdan yaratdı), ondan sonra nəsil artırmanın ən asan yolu olan evlilik vasitəsilə sizi spermadan yaratdı. (ثُمَّ مِنْ عَلَقَةٍ) - Ondan sonra spermanı ananın bətnində dolandırıb, bir parça laxtalanmış qan edib sizi o qandan yaratdı. (ثُمَّ يُخْرِجُكُمْ طِفْلًا) - Ondan sonra sizi o möhtac uşaq halətinizdə ana bətnindən çıxardı. (ثُمَّ لِتَبْلُغُوٓا اَشُدَّكُمْ) - Ondan sonra Allah-Təala sizin** (bədənin səhhət və qüvvətinə görə) **həyatınızı davam etdirər ki, yetkin insan olub, hər bir əzanız möhkəmlənsin.**

**(ثُمَّ لِتَكُونُوا شُيُوخًاۚ) - Ondan sonra sizi sağ qoyar ki, qocalıq halətinə yetişəsiniz. (وَمِنْكُمْ مَنْ يُتَوَفّٰى مِنْ قَبْلُ) - Amma sizdən bəzilərini bu halətlərdən qabaq** (bədənə varid olan qüsurlar səbəbi ilə) **vəfat etdirər. (وَلِتَبْلُغُوٓا اَجَلًا مُسَمًّى) - Siz insan nəslini bu halətlərdə saxlayarıq ki, hər bir nəfs ondan ötrü müəyyən olan vaxta yetişib, o vaxt da ölüm sizə gələr. (وَلَعَلَّكُمْ تَعْقِلُونَ) Əlbəttə, bu bəhs olunan dəlillərə ağılla fikir verib, gərək ibrət alasınız.**

**68) (هُوَ الَّذ۪ي يُحْي۪ وَيُم۪يتُ) - Sizi öldürüb, dirildən Allah-Təaladır. Allah-Təaladan başqa heç bir şəxs öldürməyə və həyat verməyə qadir deyildir. (فَاِذَا قَضٰٓى اَمْرًا فَاِنَّمَا يَقُولُ لَهُ كُنْ فَيَكُونُ) - Elə ki, Allah-Təala öz kamil qüdrəti ilə bir şeyin olmasına hökm edib, əzəli iradəsi ilə qərar verdi, həqiqətən, o şeyə deyər: "Ol!" O şey də gecikmədən var olar.** (Allah-Təalanın belə deməsi bizə anlatmaq üçündür. Məxluqatın yaranması üçün onun əzəli iradəsi kifayət edər, yoxsa Allah-Təalanın pak zatı insana məxsus olan danışmaqdan ucadır).

**69) (اَلَمْ تَرَ اِلَى الَّذ۪ينَ يُجَادِلُونَ ف۪ٓي اٰيَاتِ اللّٰهِۜ اَنّٰى يُصْرَفُونَ) -** (Ey Məhəmməd), **bəs Allah-Təalanın ayələri** (Qurani-Şərif) **haqqında mübahisə edib, onu batil etmək fikrində olanlara baxmırsan ki, necə (şəri əmr edən xəbis nəfsləri) onları bizə itaət və ibadət etməkdən qaytarıb, bizə şərik qoşurlar?**

**70) (اَلَّذ۪ينَ كَذَّبُوا بِالْكِتَابِ وَبِمَٓا اَرْسَلْنَا بِه۪ رُسُلَنَاۜ فَسَوْفَ يَعْلَمُونَ) -** (Ey Məhəmməd), **o şəxslər ki, (Quranı) və o kitablar ki, onlarla peyğəmbərlərimizi insanlara hidayət etməkdən ötrü göndərmişik, təkzib etdilər, əlbəttə, agah olacaqlar ki, onlara necə əzab olunacaqdır.**

**71-72) (اِذِ الْاَغْلَالُ ف۪ٓي اَعْنَاقِهِمْ وَالسَّلَاسِلُۜ يُسْحَبُونَ فِي الْحَم۪يمِ) - O zaman agah**

ثُمَّ فِي النَّارِ يُسْجَرُونَ ﴿٧٢﴾ ثُمَّ قِيلَ لَهُمْ اَيْنَ مَا كُنْتُمْ تُشْرِكُونَ ﴿٧٣﴾ مِنْ دُونِ اللّٰهِ قَالُوا ضَلُّوا
عَنَّا بَلْ لَمْ نَكُنْ نَدْعُوا مِنْ قَبْلُ شَيْـًٔا كَذٰلِكَ يُضِلُّ اللّٰهُ الْكَافِرِينَ ﴿٧٤﴾ ذٰلِكُمْ بِمَا كُنْتُمْ تَفْرَحُونَ
فِي الْاَرْضِ بِغَيْرِ الْحَقِّ وَبِمَا كُنْتُمْ تَمْرَحُونَ ﴿٧٥﴾ اُدْخُلُوا اَبْوَابَ جَهَنَّمَ خَالِدِينَ فِيهَا فَبِئْسَ مَثْوَى
الْمُتَكَبِّرِينَ ﴿٧٦﴾ فَاصْبِرْ اِنَّ وَعْدَ اللّٰهِ حَقٌّ فَاِمَّا نُرِيَنَّكَ بَعْضَ الَّذِي نَعِدُهُمْ اَوْ نَتَوَفَّيَنَّكَ فَاِلَيْنَا
يُرْجَعُونَ ﴿٧٧﴾

---

**olarlar ki, boyunlarında halqa və zəncirlər üzləriüstə şiddətlə hərarətli suyun içinə çəkilərlər. (ثُمَّ فِي النَّارِ يُسْجَرُونَ) - Ondan sonra odun içinə daxil olub, od hər bir tərəfdən onları əhatə edib, içəriləri odla dolacaqdır.**

**73) (ثُمَّ قِيلَ لَهُمْ اَيْنَ مَا كُنْتُمْ تُشْرِكُونَ مِنْ دُونِ اللّٰهِ) - Ondan sonra odun içində onlara deyilər: "O bütlər ki, Allah-Təaladan başqa onlara ibadət edib, onları Allah-Təalaya şərik sayırdınız, onlar hanı, necə oldular ki, gəlib sizə kömək etsinlər?" (قَالُوا ضَلُّوا عَنَّا) Kafirlər cavab verərlər: "O bütlər bizdən itdi, onları görmürük, ta ki, onlardan bir fayda əldə edək".**

**(بَلْ لَمْ نَكُنْ نَدْعُوا مِنْ قَبْلُ شَيْـًٔا) - Əksinə, indi bizə məlum oldu ki, o bütlər də, onlara ibadət etmək də bir şey deyilmiş, heç bir şeyə ibadət etməyib zəlalətdə qalmışıq. (كَذٰلِكَ يُضِلُّ اللّٰهُ الْكَافِرِينَ) -** (Ey Məhəmməd), **Allah-Təala bütləri kafirlərin arasından yox edən kimi kafirləri də bütlərin arasından yox edər. Əgər bir-birlərini istəsələr ki, axtarıb tapalar, tapa bilməzlər.**

**74-75) (ذٰلِكُمْ بِمَا كُنْتُمْ تَفْرَحُونَ فِي الْاَرْضِ بِغَيْرِ الْحَقِّ وَبِمَا كُنْتُمْ تَمْرَحُونَ) - Cəhənnəmdə onlara deyilər: "Sizin bu zəlalətdə olmağınız o səbəbdəndir ki, təkəbbürlənib, bütlərə ibadət edib, Allah-Təalaya şərik qoşmağa haqqınız olmadığı halda yer üzündə şad olurdunuz.**

**76) (اُدْخُلُوا اَبْوَابَ جَهَنَّمَ خَالِدِينَ فِيهَا فَبِئْسَ مَثْوَى الْمُتَكَبِّرِينَ) -** (Ey Məhəmməd), **o vaxt da kafir və asilərə deyilər: "Cəhənnəmin hansı qapısından istəyirsiniz, daxil olun, onsuz da həmişə cəhənnəmdə olacaqsınız. Təkəbbürlülərin yeri** (cəhənnəm) **nə yaman yerdir.**

**77) (فَاصْبِرْ اِنَّ وَعْدَ اللّٰهِ حَقٌّ) -** (Ey Məhəmməd), **müşriklərin əziyyətinə səbir et, həqiqətən, Allah-Təalanın kafirləri həlak etmək vədi haqdır, əlbəttə, vaqe olacaqdır. (فَاِمَّا نُرِيَنَّكَ بَعْضَ الَّذِي نَعِدُهُمْ) - Lakin** (Ey Məhəmməd), **onlara vəd etdiyimiz əzabın bəzisini ya sənə göstərib, səni onların məğlub olması ilə şad edərik, (اَوْ نَتَوَفَّيَنَّكَ فَاِلَيْنَا يُرْجَعُونَ) - ya da ki, onların məğlub və zəlil olmasından heç bir şey sənə göstərməmiş səni vəfat etdirərik.** (Lakin şübhəsiz ki, onları məğlub və zəlil edəcəyik). **Amma ölüm onlara gələndən sonra hamısı qiyamət günündə bizim tərəfimizə qayıdarlar, onlardan intiqam alarıq, o vaxt da görərsən.** (Allah-Təala ayədə müşriklərə dünyada əzab edilməsini və zəlil olub-olmayacağını Allahın Rəsulu üçün qeyri-müəyyən

وَلَقَدْ اَرْسَلْنَا رُسُلًا مِنْ قَبْلِكَ مِنْهُمْ مَنْ قَصَصْنَا عَلَيْكَ وَمِنْهُمْ مَنْ لَمْ نَقْصُصْ عَلَيْكَ ۗ وَمَا كَانَ
لِرَسُولٍ اَنْ يَاْتِيَ بِاٰيَةٍ اِلَّا بِاِذْنِ اللّٰهِ ۚ فَاِذَا جَٓاءَ اَمْرُ اللّٰهِ قُضِيَ بِالْحَقِّ وَخَسِرَ هُنَالِكَ الْمُبْطِلُونَ ۟﴿٧٨﴾ اَللّٰهُ
الَّذِي جَعَلَ لَكُمُ الْاَنْعَامَ لِتَرْكَبُوا مِنْهَا وَمِنْهَا تَاْكُلُونَ ۟﴿٧٩﴾ وَلَكُمْ فِيهَا مَنَافِعُ وَلِتَبْلُغُوا عَلَيْهَا حَاجَةً
فِي صُدُورِكُمْ وَعَلَيْهَا وَعَلَى الْفُلْكِ تُحْمَلُونَ ۗ﴿٨٠﴾ وَيُرِيكُمْ اٰيَاتِهٖۗ فَاَيَّ اٰيَاتِ اللّٰهِ تُنْكِرُونَ ﴿٨١﴾
اَفَلَمْ يَسِيرُوا فِي الْاَرْضِ فَيَنْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الَّذِينَ مِنْ قَبْلِهِمْ ۗ

---

edir ki, o cənabın həvəsi daha da artsın. Lakin Allah-Təala onların zillətini bir neçə dəfə o cənaba göstərdi).

**78) (وَلَقَدْ اَرْسَلْنَا رُسُلًا مِنْ قَبْلِكَ مِنْهُمْ مَنْ قَصَصْنَا عَلَيْكَ وَمِنْهُمْ مَنْ لَمْ نَقْصُصْ عَلَيْكَ) -** (Ey Məhəmməd), **həqiqətən səndən əvvəl peyğəmbərlər göndərmişik, onlardan bəzisinin qissəsini sənə deyib, bəzisini deməmişik. Necə ki səndən qabaq onlardan da hökm edib möcüzə istəyiblər.** (Müşriklər hökm edib Allahın Rəsuluna deyirdilər: "Əgər filan möcüzəni gətirsən, sənə iman edərik. Onların cavabında Allah-Təala bu ayəni buyurur:)

**(وَمَا كَانَ لِرَسُولٍ اَنْ يَاْتِيَ بِاٰيَةٍ اِلَّا بِاِذْنِ اللّٰهِ) - heç bir peyğəmbər Allah-Təalanın icazəsi və iradəsi olmadan möcüzə gətirə bilməz, öz yanlarından möcüzə göstərməyə qadir olmayıblar. O möcüzələr ki, (ey Məhəmməd,) səndən istəyirlər, onları sən haradan gətirəcəksən?**

**(فَاِذَا جَٓاءَ اَمْرُ اللّٰهِ قُضِيَ بِالْحَقِّ وَخَسِرَ هُنَالِكَ الْمُبْطِلُونَ) - O zaman ki qiyamət, ya da Bədir savaşı günü Allah-Təalanın əmri zahir oldu, haqq və ədalətlə xalqın arasında hökm olunar, o vaxt da o inadkarlar ki, səndən möcüzə istəyib, ən əla möcüzə olan Qurani-Şərifi inkar ediblər, nəfslərinə ziyan vurub, nicat tapmayacaqlar.** (Necə ki Bədir savaşında nicat tapmadılar).

**79-80) ( اَللّٰهُ الَّذِي جَعَلَ لَكُمُ الْاَنْعَامَ لِتَرْكَبُوا مِنْهَا وَمِنْهَا تَاْكُلُونَ) - Allah-Təala siz insanlara mərhəmət edib sizdən ötrü** (dəvə, inək, qoyun, keçi) **yaratdı ta ki, onların bəzisini yeyib, bəzisini minəsiniz. (وَلَكُمْ فِيهَا مَنَافِعُ وَلِتَبْلُغُوا عَلَيْهَا حَاجَةً فِي صُدُورِكُمْ) - Siz insanlardan ötrü o heyvanların yununda, tükündə və südündə nə çox mənfəətlər vardır və o heyvanların bəzisi ilə** (dəvə və inək ilə) **qəlblərinizdə olan arzuya (bir yerdən digər bir yerə mal nəql etmək) yetişirsiniz.** (Hər nə qədər dünyada elm qüvvəsilə miniklər meydan gəlsə də, yenə bu heyvanlara ehtiyac olacaqdır). **(وَعَلَيْهَا وَعَلَى الْفُلْكِ تُحْمَلُونَ) - Çöldə heyvanlara, dənizdə gəmilərə minib, məqsədinizə çatırsınız.**

**81) (وَيُرِيكُمْ اٰيَاتِهٖ) - Allah-Təala tövhid və qüdrətinə işarə edən ayələri siz insanlara göstərir ki, şirki tərk edib müvəhhid olasınız. Amma siz ibrət almırsınız. (فَاَيَّ اٰيَاتِ اللّٰهِ تُنْكِرُونَ) - Allah-Təalanın göstərdiyi ayə və sübutların onun tövhid və qüdrətinə olan işarəsi zahir və aşkardır. Heç birini inkar etmək olmaz, siz müşriklər hansı birini inkar edirsiniz?**

**82) (اَفَلَمْ يَسِيرُوا فِي الْاَرْضِ فَيَنْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الَّذِينَ مِنْ قَبْلِهِمْ)** - (Ey Məhəmməd),

كَانُوٓا اَكْثَرَ مِنْهُمْ وَاَشَدَّ قُوَّةً وَاٰثَارًا فِي الْاَرْضِ فَمَآ اَغْنٰى عَنْهُمْ مَا كَانُوا يَكْسِبُونَ﴿٨٢﴾ فَلَمَّا
جَآءَتْهُمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ فَرِحُوا بِمَا عِنْدَهُمْ مِنَ الْعِلْمِ وَحَاقَ بِهِمْ مَا كَانُوا بِهٖ يَسْتَهْزِؤُنَ ﴿٨٣﴾
فَلَمَّا رَاَوْا بَاْسَنَا قَالُوٓا اٰمَنَّا بِاللهِ وَحْدَهُ وَكَفَرْنَا بِمَا كُنَّا بِهٖ مُشْرِكِينَ﴿٨٤﴾ فَلَمْ يَكُ يَنْفَعُهُمْ إيمَانُهُمْ لَمَّا
رَاَوْا بَاْسَنَا سُنَّتَ اللهِ الَّتِي قَدْ خَلَتْ فِي عِبَادِهٖ وَخَسِرَ هُنَالِكَ الْكَافِرُونَ﴿٨٥﴾

---

**müşriklər yer üzünü seyr edib səfərə getməyiblər ki,** (Şama, Yəmənə gedib-gəlməyiblər ki,) **baxıb görsünlər, onlardan əvvəlki ümmətlərdən peyğəmbərləri təkzib edənlərin axırı necə oldu?**

(كَانُوٓا اَكْثَرَ مِنْهُمْ وَاَشَدَّ قُوَّةً وَاٰثَارًا فِي الْاَرْضِ) **- Onların sayı bu müşriklərdən həm çox, həm qüvvətləri artıq idi və yer üzündə möhkəm qalaları, binaları daha çox idi.** (فَمَآ اَغْنٰى عَنْهُمْ مَا كَانُوا يَكْسِبُونَ) **- Dünyada qazandıqları malları və qəsrləri onlara heç bir fayda verməyib, əzab onlara gəlib, hamısı həlak oldular.**

**83)** (فَلَمَّا جَآءَتْهُمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ فَرِحُوا بِمَا عِنْدَهُمْ مِنَ الْعِلْمِ) **-** (Ey Məhəmməd), **o zaman ki, əvvəlki ümmətlərə göndərilən peyğəmbərlər özlərinin doğruluğuna işarə edən dəlil və sübutlarla gəldilər, onların sözlərini qəbul etməyib, öz elmlərinə** (bütlərə sitayiş edib şirkdə qalmağa) **- hansı ki, elm deyildi, sevinib, peyğəmbərlərə istehza etdilər.** (وَحَاقَ بِهِمْ مَا كَانُوا بِهٖ يَسْتَهْزِؤُنَ)**- Peyğəmbərlərə etdikləri istehzanın cəzası onları sarıb, əzab onları tutdu.**

**84)** (فَلَمَّا رَاَوْا بَاْسَنَا قَالُوٓا اٰمَنَّا بِاللهِ وَحْدَهُ) **- Elə ki bizim əzabımızın gəldiyini gördülər, labüd əlacsız qalıb dedilər: "Yeganə Allah-Təalaya iman etdik".**

(وَكَفَرْنَا بِمَا كُنَّا بِهٖ مُشْرِكِينَ) **- O bütlər ki onları Allah-Təalaya şərik sayırdıq, onlara kafir olduq".**

**85)** (فَلَمْ يَكُ يَنْفَعُهُمْ إيمَانُهُمْ لَمَّا رَاَوْا بَاْسَنَا) **-** (Ey Məhəmməd), **bizim əzabımızı görən zaman iman etmək, onlara fayda verməyib hamısı həlak oldular.** (Necə ki bu Qüreyş camaatına fayda verməyib zəlil və həlak olacaqlar. Bədir günündə hamısı peşman olub onlara fayda vermədi). (سُنَّتَ اللهِ الَّتِي قَدْ خَلَتْ فِي عِبَادِهٖ) **- Allah-Təalanın bəndələrinin haqqında adəti belədir ki, əzab gələn vaxt tövbə qəbul olunmasın.** (وَخَسِرَ هُنَالِكَ الْكَافِرُونَ) **- Əzab gələn vaxt etdiyi imanı qəbul olmayan kafirlərin nəfslərinə ziyan dəyib, onlardan ötrü nicat olmayacaqdır.**

**Allaha həmd olsun, Mömin surəsinin təfsiri tamam oldu. Allahın Rəsulu buyurubdur: "Kim Mömin surəsini oxusa, peyğəmbərlərin, doğruların, şəhidlərin və möminlərin ruhları ona rəhmət göndərib, ondan ötrü əfv istəyər."**

## FUSSİLƏT SURƏSİ

41-ci surədir. Məkkədə nazil olub, 53 ayə, 796 kəlmə və 3350 hərfdir.

حٰمٓ ﴿١﴾ تَنْزِيلٌ مِنَ الرَّحْمٰنِ الرَّحِيمِۚ ﴿٢﴾ كِتَابٌ فُصِّلَتْ اٰيَاتُهُ قُرْاٰنًا عَرَبِيًّا لِقَوْمٍ يَعْلَمُونَۙ ﴿٣﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (حٰمٓ) - Bu surənin adıdır.**

**2) (تَنْزِيلٌ مِنَ الرَّحْمٰنِ الرَّحِيمِۚ) - Bu surə dünya və axirətdə rəhm edən Allah-Təaladan nazil olubdur.**

**3) (كِتَابٌ فُصِّلَتْ اٰيَاتُهُ قُرْاٰنًا عَرَبِيًّا لِقَوْمٍ يَعْلَمُونَ) - Bu Quran elə bir kitabdır ki, ərəb dilində olduğu halda (hansı ki, dillərin ən gözəlidir) alimlərdən ötrü müxtəlif mənalarda (ehkam, vəz və qissələrdə) onun ayələri təfsilatla* verilib. Bir-birindən seçilib ayrılıblar, onlarda bir şübhə, ya da bir əyrilik, hansı ki, bir-birinə qarışıb, mətləb və muradı, mənası naməlum olan şey yoxdur. Əksinə, onun parlaq ləl-cəvahir kimi olan ayələrini doğru şəkildə təfəkkür edənlərdən ötrü uca faydaları ehtiva etməsi açıq-aşkardır.**

*(*Qeyd: "Sonsuz fəsahət və bəlağəti ehtiva edən kəlamın mənası və faydaları, əlbəttə, gərək, asan yolla anlaşılsın və dili bilənlər ondan faydalana bilsinlər. Qurani-Şərifin fəsahət və bəlağətin ən uca dərəcəsində olması bəlağət alimlərincə açıq-aşkardır.*

*Belə bir kitabın mənasının məqsədi, əlbəttə, gərək dili bilənlərdən ötrü aydın olsun. Nəinki az sayda şəxs ona agah olub, qalanları mənasından məhrum olsunlar. Necə ki islam ümmətindən bir qrup belə deyib, Qurani-Şərifin elmini 12 imama həvalə edirlər. Görəsən, fəsahət və bəlağətin ən uca dərəcəsini ehtiva edən kəlamın faydası budurmu? Ərəb dilinə agah olanlar onun qanunlarını tamamilə ortaya qoyublar.*

*Lakin Qurani-Şərifin ümumi faydasını hansı ki onların şəxsi mənfəətlərinə zərərdir, xalqdan gizlədib məxfi sayıblar. Lakin öz sözlərinin qəbul olunmaması qorxusundan Quran elminin bir qismini Allah-Təalaya, bir qismini də ancaq peyğəmbərə və imamlara həvalə etməklə məqsədlərinə çatıblar və bu səbəbdən islam dinində bidətlər (uydurma əlavələr) və islam ümməti arasında ixtilaflar meydana çıxıb, müxtəlif məzhəblər yaranıbdır. Qurani-Şərifdən aralanmaq müxtəlif məzhəblərin yaranmasına səbəb olubdur).*

بَشِيرًا وَنَذِيرًاۚ فَاَعْرَضَ اَكْثَرُهُمْ فَهُمْ لَا يَسْمَعُونَ ﴿٤﴾ وَقَالُوا قُلُوبُنَا فِي اَكِنَّةٍ مِمَّا تَدْعُونَٓا اِلَيْهِ وَفِي
اٰذَانِنَا وَقْرٌ وَمِنْ بَيْنِنَا وَبَيْنِكَ حِجَابٌ فَاعْمَلْ اِنَّنَا عَامِلُونَ ﴿٥﴾ قُلْ اِنَّمَٓا اَنَا۠ بَشَرٌ مِثْلُكُمْ يُوحٰى اِلَيَّ اَنَّمَٓا
اِلٰهُكُمْ اِلٰهٌ وَاحِدٌ فَاسْتَقِيمُوٓا اِلَيْهِ وَاسْتَغْفِرُوهُۜ وَوَيْلٌ لِلْمُشْرِكِينَۙ ﴿٦﴾ اَلَّذِينَ لَا يُؤْتُونَ الزَّكٰوةَ وَهُمْ
بِالْاٰخِرَةِ هُمْ كَافِرُونَ﴿٧﴾ اِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ لَهُمْ اَجْرٌ غَيْرُ مَمْنُونٍ۟﴿٨﴾

---

**4) (بَشِيرًا وَنَذِيرًاۚ) - Bu Quran möminlərə müjdə verən, asiləri əzabla qorxudan halda göndərilibdir. (فَاَعْرَضَ اَكْثَرُهُمْ فَهُمْ لَا يَسْمَعُونَ) - Lakin insanların əksəriyyəti Qurandan üz döndərib, onun ehkamına qulaq asmayıb, itaət etmirlər.**

**5) (وَقَالُوا قُلُوبُنَا فِي اَكِنَّةٍ مِمَّا تَدْعُونَٓا اِلَيْهِ) -** (Ey Məhəmməd), **elə ki sən bu müşrikləri bizim tərəfimizə dəvət edirsən, onlar sənə cavab verib deyirlər: "Bizim qəlblərimizə daxil olmur, (وَفِي اٰذَانِنَا وَقْرٌ وَمِنْ بَيْنِنَا وَبَيْنِكَ حِجَابٌ) - qulaqlarımızda da ağırlıq vardır. Sənin sözünü eşitmirik. Din məsələsində səninlə bizim aramızda pərdə və maneə vardır. Heç vaxt sənə tabe ola bilmərik.**

**(فَاعْمَلْ اِنَّنَا عَامِلُونَ) - Sən öz dininə əməl et, biz də öz dinimizə əməl edərik. Daha sən bizə mane olma.**

**6) (قُلْ اِنَّمَٓا اَنَا۠ بَشَرٌ مِثْلُكُمْ يُوحٰى اِلَيَّ اَنَّمَٓا اِلٰهُكُمْ اِلٰهٌ وَاحِدٌ) -** (Ey Məhəmməd), **müşriklərin cavabında de: "Həqiqətən, mən də sizin kimi insanam, tanrı deyiləm, əksinə, sizin özünüzdənəm. Fərqimiz bundadır ki, Allah-Təaladan mənə vəhy gəlir. Sizin məbudunuz yeganə Allah-Təaladır, ona şərik qoşmayın, nədən ötrü mənim sözümü eşitməyib tabe olmursunuz? Mən elə bir xilaf söz demirəm. (فَاسْتَقِيمُوٓا اِلَيْهِ وَاسْتَغْفِرُوهُۜ وَوَيْلٌ لِلْمُشْرِكِينَ) - Heç bir şeyə yönəlməyib, hər bir əməlinizi Allah-Təalaya məxsus edib, müvəhhid olub, günahlarınızdan tövbə edib Allah-Təalanın tərəfinə qayıdın və müşriklərdən ötrü əzab hazır olunubdur".**

**7) (اَلَّذِينَ لَا يُؤْتُونَ الزَّكٰوةَ وَهُمْ بِالْاٰخِرَةِ هُمْ كَافِرُونَ) - Müşriklərin xüsusiyyətlərindən biri budur ki,* zəkatı verməyib, axirəti** (qiyamət gününü) **inkar edib, kafir olarlar.**

**8) (اِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ لَهُمْ اَجْرٌ غَيْرُ مَمْنُونٍ۟) - Həqiqətən, o şəxslər ki, iman edib, xeyir əməl edib, (zəkat) verə, onlardan ötrü sonu olmayan əcr və savab vardır.** (Bundan sonra bəhs olunan ayələrdə yerin, yerdə olan şeylərin və göylərin neçə gündə yaradıldığı bəyan olunur).

*(*Qeyd: "Müşriklərin sifətlərindən bircə zəkat verməməyi qeyd etməyin mənası odur ki, insan üçün özündən də çox sevdiyi dünya malından başqa heç bir sevimli şey yoxdur. Nə zaman ki, bir şəxs dünya malından keçib, din və millət yolunda sərf etdi, həqiqətən o şəxs din və millət yolunda ruhundan keçmiş kimidir. Var-dövlət xərcləmək o şəxsin dinində sabit olmasına, düz istiqamətinə*

*və doğru niyyətinə, din və milləti sevdiyinə işarə edir. Xüsusən zəkat ki, islam dinində sırf millətin halını islah etmək və nöqsanlarını düzəltmək üçün, din və millətin tərəqqisindən ötrü vəz olunubdur. Əlbəttə, dindarlığın əsas şərti dinin tərəqqisi üçün cəhd və qeyrət etmək, xüsusən var-dövlət xərcləməkdir. Hansı ki, ona böyük cihad demək daha doğrudur və bu səbəbdən Allah-Təala zəkatı dinin vacib əmrlərindən saymışdır. Belə ki, tərk edilməyib, islam dini onunla rəvac və qüvvət tapsın. Maldan keçmək nəfs üçün ağır və məşəqqətli bir şey olub, Allah-Təala yanında böyük dərəcəyə sahibdir, zəkatı vermək istəməməyi isə axirətə inanmamaqla bir qeyd edib, əvəzində zəkat verməyənlərin kafirlərin qatarına mənsub olmasına işarə edir. Ərəblərdən Bəni-Hənifə camaatı zəkat vermək istəmədiyi üçün mürtəd hesab olunub, xəlifə Əbu Bəkir onlara qarşı cihad etməyi əmr etdi. Zəkatdan bir hissəni Allah-Təala o kafirlərdən ötrü təyin edibdir ki, onlar müsəlmanlara kömək olub, islam dövlətinin sərhədlərini mühafizə etsinlər. Ey Allahım, belə bir böyük əmr müsəlmanların arasından necə tərk olunub ki, cəhalət müsəlmanlara qalib gəlib. Hər qrup zəkat barəsində bir cür əməl edibdir. Qurani-Şərifdə "qeydsiz-şərtsiz" əmr edilən zəkatı – malın onda birini verməyi bir çox şərtə bağlayıb, əkinçilərə məxsus edib, var-dövlət sahiblərini bundan azad sayıblar. Belə bir şey olarmı ki, Qurani-Şərifdə millətin xeyrindən ötrü əmr edilən ümumi qanun əkinçilərə məxsus edilsin? Görəsən, onlardan hasil olan məbləğlə bir millətin halı islah olarmı? Əksinə, millətin bütün fərdləri gərək hər ilin əvvəlində qazandıqları faydanın onda birini versinlər ki, millətin əskiklikləri tamamlanıb, ruziləri çoxalsın. Bəs İsa ibn Məryəm və Yəhya əkinçi idi ki, Allah-Təala onların zəkat verməsini Qurani-Şərifdə qeyd edir? Görəsən, bunlar zəkatı nədən verirdilər? Biz islam alimlərinin özümüzü alim saymağımızın mənası budur ki, Qurani-Şərifdən bir şey anlamırıq. Bunlardan keçəndən sonra əkinçilərdən hasil olan zəkat haraya sərf olunur? O, zahirdə adını elm əhli qoyub, batində din və millətin yolunu kəsənlərə məxsus olubdur. Zəkat almağı özləri üçün vacib, başqasına verməyi batil sayıblar, xalqı da elə öyrədiblər, avamlar da onların hiyləli sözlərinə aldanıb, zəkatı onlara verməklə özlərini və ata-balarını uca firdövs cənnətinin əhli hesab edib, guya o zəkatı Allah Rəsulunun özünə verirlər. Biçarə əkinçilər ağır zəhmətlə qazandıqları məhsulun onda birini həqircəsinə aparıb bir nəhs gündə uca peyğəmbərin (ə.s) "Kafirlər bir dəfəyə yeddi dəfədən də çox yeyər" sözünün təsdiqi olan din düşməninə verib hələ bir üzr də istəyirlər. O böyük oğru da hələ bir ona minnət qoyub, qəbul edib, hara gəldi sərf edər. Bu mövzuda çox yazmaqdan bezdim. Əlbəttə, oxucuların əksəriyyəti də bundan bezəcəkdir. Lakin pak qardaşlarıma salam deyib, bu məsələnin düşünülməsini tövsiyə edirəm).*

**9) (قُلْ اَئِنَّكُمْ لَتَكْفُرُونَ بِالَّذٖي خَلَقَ الْاَرْضَ فٖي يَوْمَيْنِ) -** (Ey Məhəmməd), **müşriklərə**

وَتَجْعَلُونَ لَهُ اَنْدَادًاۜ ذٰلِكَ رَبُّ الْعَالَمِينَۚ ﴿٩﴾ وَجَعَلَ فِيهَا رَوَاسِيَ مِنْ فَوْقِهَا وَبَارَكَ فِيهَا وَقَدَّرَ فِيهَآ
اَقْوَاتَهَا فٖيٓ اَرْبَعَةِ اَيَّامٍ سَوَآءً لِلسَّآئِلِينَ ﴿١٠﴾ ثُمَّ اسْتَوٰىٓ اِلَى السَّمَآءِ وَهِيَ دُخَانٌ فَقَالَ لَهَا وَلِلْاَرْضِ
ائْتِيَا طَوْعًا اَوْ كَرْهًاط قَالَتَآ اَتَيْنَا طَآئِعِينَ ﴿١١﴾

---

**de ki, bəs siz kafir olursunuz elə bir Allah-Təalaya ki, bu əzəməti ilə yeri iki gündə yaradıb?** (Allah-Təala hər bir şeyi yaratmağa qadirdir, lakin əvvəlcə gərək səbəbləri mövcud olsun. Səbəblərin yaradılması üçün də zaman lazımdır və bu səbəbdən özü də bir məxluq olan zamandan iki günü yerin yaradılmasının səbəbləri üçün ayırdığını ifadə etmişdir. Habelə bundan sonra bəhs olunan dörd gün və göylərin yaradılması üçün bəhs olunan iki gün nisbi sayılmalıdır). **(وَتَجْعَلُونَ لَهُ اَنْدَادًاۜ ذٰلِكَ رَبُّ الْعَالَمِينَ) - Belə bir qüdrət sahibi Allah-Təaladan ötrü ziddiyyət və şəriklər qoşursunuz. Aləmlərə nizam verən bu Allah-Təaladır, nəinki sizin bütləriniz.**

**10) (وَجَعَلَ فِيهَا رَوَاسِيَ مِنْ فَوْقِهَا) - Allah-Təala öz kamil qüdrəti ilə yer üstündə uca və möhkəm dağlar yaratdı.** (ki onlara baxanlar təfəkkür etsinlər. Bu ağır dağların yerin üstündə, onların da dənizlərlə birlikdə havada sütunsuz olaraq havada durması mükəmməl bir qüdrət sahibi olan mühafizəçiyə ehtiyacı olduğunu göstərir. O mühafizəçi yeganə və mütləq qüdrət sahibi olan olan Allah-Təaladır). **(وَبَارَكَ فِيهَا) - Allah-Təala yeri yaradıb, ona xeyir və bərəkət verdi. (وَقَدَّرَ فِيهَآ اَقْوَاتَهَا فٖيٓ اَرْبَعَةِ اَيَّامٍ سَوَآءً) - Allah-Təala yer əhlindən ötrü onların ruzilərini yerdə təyin etdi. Yerin yaradılmasını, dağların yerdə təşkilini və ruzilərin təqdir edilməsini, hamısını dörd eyni gündə tamamladı. (لِلسَّآئِلِينَ) - Dörd günün ifadə edilməsinin səbəbi budur: "Əgər soruşsalar ki, yer və dağlar neçə gündə yaradılıb və ruzilər neçə gündə təqdir olunub, o zaman onlara bu dörd günlə cavab verilsin.**

**11) (ثُمَّ اسْتَوٰىٓ اِلَى السَّمَآءِ وَهِيَ دُخَانٌ) -** (Ey Məhəmməd), **Allah-Təala yeri yaradıb, onun ehtiyacı olan şeyləri təqdir edəndən sonra öz kamil qüdrəti ilə sizin başınız tərəfinə, havadakı duman** (tüstü) **kimi* olan** (göyə) **yönəldi.** (Necə ki, indi də elə görünür). **(فَقَالَ لَهَا وَلِلْاَرْضِ ائْتِيَا طَوْعًا اَوْ كَرْهًا) - Allah-Təala göyə və yerə xitab edib buyurdu: "Ya öz istəyinizlə, ya da məcburən, hər bir halda mənə tərəf gəlib, itaət edin. (قَالَتَآ اَتَيْنَا طَآئِعِينَ) - Göy və yer cavab verib dedilər: "Məcbur olmadan sənə tərəf gəlib, itaət etdik.** (Göy və yerin Allah-Təalanın qüdrətinə tabe olması onların itaət etməsi şəklində ifadə edilir).

*(***Qeyd:** "Yuxarı tərəfə baxanda hava saf və sakit olan vaxtda bir-birinin üstünə cəm olub qalınlığından duman kimi kobud rəng nəzərə gəlir. Hava insanın yaşaması üçün birinci şərt olduğu və insanın həyatı Allah-Təalanın qüdrətinə tabe olduğu üçün havaya yönəlmək ifadəsi işlədildi).*

فَقَضٰيهُنَّ سَبْعَ سَمٰوَاتٍ فٖي يَوْمَيْنِ وَاَوْحٰى فٖي كُلِّ سَمَٓاءٍ اَمْرَهَاۜ وَزَيَّنَّا السَّمَٓاءَ الدُّنْيَا بِمَصَابٖيحَۗ وَحِفْظًاۜ ذٰلِكَ تَقْدٖيرُ الْعَزٖيزِ الْعَلٖيمِ ﴿١٢﴾ فَاِنْ اَعْرَضُوا فَقُلْ اَنْذَرْتُكُمْ صَاعِقَةً مِثْلَ صَاعِقَةِ عَادٍ وَثَمُودَۜ ﴿١٣﴾

---

**12)** (فَقَضٰيهُنَّ سَبْعَ سَمٰوَاتٍ فٖي يَوْمَيْنِ) **- İki gün içində Allah-Təala göyün yeddi qat** (yeddi səma) **olmasına hökm verib qərar verdi.** (Yerin və göyün yaradılmasının iki gün bu ayədə, dörd gün əvvəlki ayədə, cəmi 6 gün içində meydana gəldiyini xəbər verir). (وَاَوْحٰى فٖي كُلِّ سَمَٓاءٍ اَمْرَهَا) **- Allah-Təala hər bir səmada** (sonsuz fəza) **sabit və heyrət içindəki kürələrin məxluquna onların iş nizamını və məişət xüsusiyyətlərini, necə yaşamaları gərəkdiyini vəhy edib onlara təlim etdi.** (وَزَيَّنَّا السَّمَٓاءَ الدُّنْيَا بِمَصَابٖيحَۗ وَحِفْظًا) - (Ey Məhəmməd), **bu dünya səması ki, görürsünüz, ona işıqlı çıraq kimi ulduzlarla zinət verdik və mühafizə edib, korluqdan sizi qoruduq.** (ذٰلِكَ تَقْدٖيرُ الْعَزٖيزِ الْعَلٖيمِ) **- Bunlar hamısı məxluqata qalib və hər bir şeyə agah olan Allah-Təalanın təqdiridir ki, hər bir şeyin yaradılmasını hikmət üzrə təqdir edibdir.**

**13)** (فَاِنْ اَعْرَضُوا فَقُلْ اَنْذَرْتُكُمْ صَاعِقَةً مِثْلَ صَاعِقَةِ عَادٍ وَثَمُودَ) - (Ey Məhəmməd), **əgər müşriklər onlara bəyan olunan dəlil və sübutlardan sonra səndən üz çevirib, iman etməyələr, o vaxt onlara de: "Sizi* qorxuduram Ad və Səmud camaatına gələn o şiddətli səsin eynisi ilə ki, o səsin səbəbi ilə sizə əzab gəlib, həlak olasınız.**

*(*Qeyd: "Məkkədə Qüreyş müşrikləri cəm olub Allahın Rəsulu haqqında söhbət edirdilər. Onların arasından Əbu Cəhl durub dedi: "Ey Qüreyş camaatı, Məhəmmədin işi bizim üçün şübhəlidir. Kaş ki, şeirə, falçılığa və sehrbazlığa agah olan bir kişi tapaydınız. O kişi gedib onunla danışıb, ondan sonra gəlib onun əməlinin həqiqətini sizə bəyan edəydi." Qüreyşin rəislərindən Utbə ibn Rəbiə durub dedi: "And olsun Allah-Təalaya, mən şeiri, falçılığı və sehrbazlığı eşidib, hamısına agaham. Mən gedib onunla danışaram. Utbə ibn Rəbiə Allah Rəsulunun hüzuruna gedib dedi: "Ey Məhəmməd, sən yaxşısan, ya Haşim, sən yaxşısan, ya Əbdülmüttəlib, sən yaxşısan, ya Abdullah? Niyə bizim məbudları pisləyib, bizi zəlalətə isnad edirsən? Əgər bu sözlərdən məqsədin hakimiyyətdirsə, səndən ötrü bir bayraq tərtib edək ki, bizə rəis olasan. Ya əgər arzun şəhvətdirsə, Qüreyşin hansı qızını istəyirsən, 10 qızla səni evləndirək, ya əgər məqsədin var-dövlət cəm edib, mal sahibi olmaqsa, səndən ötrü o qədər mal cəm edək ki, özün və özündən sonra ailənin hamısı ehtiyacsız, varlı olsunlar. Utbə bu sözləri danışanda, Allahın Rəsulu (ə.s) sakit idi, elə ki, Utbə sözünü bitirdi, peyğəmbər bu surəni onun üçün oxudu, 13-cü ayəyə ("Ey Məhəmməd, əgər müşriklər onlara bəyan olunan dəlil və sübutlardan sonra səndən üz döndərib, iman etməyələr, o vaxt onlara de: "Sizi qorxuduram Ad və Səmud camaatına gələn o şiddətli səsin eynisi ilə ki, o*

اِذْ جَآءَتْهُمُ الرُّسُلُ مِنْ بَيْنِ اَيْدِيهِمْ وَمِنْ خَلْفِهِمْ اَلَّا تَعْبُدُوٓا اِلَّا اللّٰهَ ۗ قَالُوا لَوْ شَآءَ رَبُّنَا لَاَنْزَلَ مَلٰٓئِكَةً
فَاِنَّا بِمَآ اُرْسِلْتُمْ بِهٖ كَافِرُونَ﴿١٤﴾ فَاَمَّا عَادٌ فَاسْتَكْبَرُوا فِي الْاَرْضِ بِغَيْرِ الْحَقِّ وَقَالُوا مَنْ اَشَدُّ مِنَّا
قُوَّةً ۗ اَوَلَمْ يَرَوْا اَنَّ اللّٰهَ الَّذٖي خَلَقَهُمْ هُوَ اَشَدُّ مِنْهُمْ قُوَّةً ۗ وَكَانُوا بِاٰيَاتِنَا يَجْحَدُونَ ﴿١٥﴾

---

*səsin səbəbi ilə sizə əzab gəlib, həlak olasınız”) yetişəndə Utbə durub əlini peyğəmbərin ağzına qoyub dedi: “Səni qan qohumluğuna and verirəm, daha ayənin arxasını oxuma. Allahın Rəsulu sakit oldu. Utbə qayıdıb evinə gedib, daha Qüreyş içinə çıxmadı. Qüreyşlilər dedilər: “Yəqin Utbə dinindən çıxıb, Məhəmmədə tabe olubdur. Gəlin onun yanına gedək. Birlikdə Utbənin yanına getdilər. Əbu Cəhl dedi: “Ya Utbə, bizim yanımıza gəlməməyindən belə məlum olur ki, Məhəmmədə tabe olubsan. Utbə qəzəblənib and içdi ki, bundan sonra əbədiyyən Məhəmməd ilə danışmaram. Ondan sonra dedi: “Mən Məhəmmədin yanına getdim və onunla danışdım. Bir kəlamla mənə cavab verdi ki nə şeir, nə falçılıq, nə də sehr deyildi. Elə ki, Ad və Səmud hekayəsinə yetişdi, ağzını tutub qan qohumluğuna and içdirdim ki, arxasını deməsin. Ey Qüreyş camaatı, siz bilirsiniz ki, Məhəmməd bir söz desə, o söz yalan olmaz. Mən qorxdum ki, sizə əzab gəlsin”).*

**14) (اِذْ جَآءَتْهُمُ الرُّسُلُ مِنْ بَيْنِ اَيْدِيهِمْ وَمِنْ خَلْفِهِمْ اَلَّا تَعْبُدُوٓا اِلَّا اللّٰهَ) - O zaman ki Ad, Səmud camaatına peyğəmbərləri hər bir tərəfdən gəlib, onları dəvət etmək üçün cəhd edib, onlara dedilər: “Yeganə Allah-Təaladan başqa bir şeyə ibadət etməyin. Şirki tərk edib, bütpərəst olmayın”.**

**(قَالُوا لَوْ شَآءَ رَبُّنَا لَاَنْزَلَ مَلٰٓئِكَةً فَاِنَّا بِمَآ اُرْسِلْتُمْ بِهٖ كَافِرُونَ) - Onlar peyğəmbərlərin cavabında dedilər: “Əgər bizim rəbbimiz Allah-Təala peyğəmbər göndərmək istəsəydi, əlbəttə məlaikə göndərərdi. Siz də bizim kimi insansınız. Siz ki, deyirsiniz: “Bizi Allah-Təala göndəribdir, sizin bu sözünüzü biz qəbul etməyib kafir olduq.** (Necə kafir oldular və necə onlara əzab gəldi, növbəti ayələrdə bəyan edir).

**15) (فَاَمَّا عَادٌ فَاسْتَكْبَرُوا فِي الْاَرْضِ بِغَيْرِ الْحَقِّ وَقَالُوا مَنْ اَشَدُّ مِنَّا قُوَّةً) - Amma Ad camaatı haqsız və ədalətsiz şəkildə yer üzündə təkəbbürlənib dedilər: “Bizdən daha cüssəli və güclü kimdir? Heç kim bizə qalib ola bilməz”.**

**(ۗ اَوَلَمْ يَرَوْا اَنَّ اللّٰهَ الَّذٖي خَلَقَهُمْ هُوَ اَشَدُّ مِنْهُمْ قُوَّةً) - Ad camaatı bu sözü deyirdi, bəs baxıb görmürdülər ki,** (fikir vermirdilər ki,) **həqiqətən, onları yaradan Allah-Təala onlardan daha güclü və onlara qalibdir və Allahın təqdirinə qüdrətinə tabe olmaqdan çıxmağa qadir deyillər. (وَكَانُوا بِاٰيَاتِنَا يَجْحَدُونَ) - Ad camaatı bizim ayələrimizin haqq olmasını bilirdilər, lakin inadkarlıqlarından inkar edirdilər.**

فَاَرْسَلْنَا عَلَيْهِمْ رِيحًا صَرْصَرًا فِيٓ اَيَّامٍ نَحِسَاتٍ لِنُذِيقَهُمْ عَذَابَ الْخِزْيِ فِي الْحَيٰوةِ الدُّنْيَا وَلَعَذَابُ الْاٰخِرَةِ اَخْزٰى وَهُمْ لَا يُنْصَرُونَ ﴿١٦﴾ وَاَمَّا ثَمُودُ فَهَدَيْنَاهُمْ فَاسْتَحَبُّوا الْعَمٰى عَلَى الْهُدٰى فَاَخَذَتْهُمْ صَاعِقَةُ الْعَذَابِ الْهُونِ بِمَا كَانُوا يَكْسِبُونَ ﴿١٧﴾ وَنَجَّيْنَا الَّذِينَ اٰمَنُوا وَكَانُوا يَتَّقُونَ ﴿١٨﴾ وَيَوْمَ يُحْشَرُ اَعْدَآءُ اللّٰهِ اِلَى النَّارِ فَهُمْ يُوزَعُونَ ﴿١٩﴾ حَتّٰٓى اِذَا مَا جَآؤُهَا شَهِدَ عَلَيْهِمْ سَمْعُهُمْ وَاَبْصَارُهُمْ وَجُلُودُهُمْ بِمَا كَانُوا يَعْمَلُونَ ﴿٢٠﴾ وَقَالُوا لِجُلُودِهِمْ لِمَ شَهِدْتُمْ عَلَيْنَا

---

**16) (فَاَرْسَلْنَا عَلَيْهِمْ رِيحًا صَرْصَرًا فِيٓ اَيَّامٍ نَحِسَاتٍ لِنُذِيقَهُمْ عَذَابَ الْخِزْيِ فِي الْحَيٰوةِ الدُّنْيَا) -** (Ey Məhəmməd), **Ad camaatının küfr və inadlarına görə neçə (8) nəhs günlərdə onlara şiddətlə hərəkət edən külək göndərdik. Belə ki, zəlil edən əzabı axirət əzabından əvvəl həyatında onlara dadızdıraq. Bilsinlər ki, onlara fayda verən deyilmiş. (وَلَعَذَابُ الْاٰخِرَةِ اَخْزٰى وَهُمْ لَا يُنْصَرُونَ) - Amma axirət əzabı əlbəttə, dünya əzabından daha şiddətli zəlil edəndir və onlara heç bir kömək də edilməz ki, əzabdan xilas olsunlar.**

**17) (وَاَمَّا ثَمُودُ فَهَدَيْنَاهُمْ فَاسْتَحَبُّوا الْعَمٰى عَلَى الْهُدٰى) -** (Ey Məhəmməd), **amma Səmud camaatına peyğəmbər göndərib onları haqq tərəfinə hidayət etdik. Onlar zəlaləti hidayətə, küfrü imana üstün saydılar.**

**(فَاَخَذَتْهُمْ صَاعِقَةُ الْعَذَابِ الْهُونِ بِمَا كَانُوا يَكْسِبُونَ) - Səmud camaatına öz qazandıqları əməllərinin səbəbi ilə zillət əzabının şiddətli** (səsi) **gəlib, hamısı həlak oldular.**

**18) (وَنَجَّيْنَا الَّذِينَ اٰمَنُوا وَكَانُوا يَتَّقُونَ) - Lakin iman edib, Allahdan qorxan şəxslərə əzabdan nicat verdik.**

**19) (وَيَوْمَ يُحْشَرُ اَعْدَآءُ اللّٰهِ اِلَى النَّارِ فَهُمْ يُوزَعُونَ) -** (Ey Məhəmməd), **qiyamət günündə Allah-Təalanın düşmənlərini cəhənnəm oduna tərəf toplayıb, saxlayarlar ki, hamısı hazır olsunlar.**

**20) (حَتّٰٓى اِذَا مَا جَآؤُهَا شَهِدَ عَلَيْهِمْ سَمْعُهُمْ وَاَبْصَارُهُمْ وَجُلُودُهُمْ بِمَا كَانُوا يَعْمَلُونَ) -** (Ey Məhəmməd), **elə ki, Allah-Təalanın düşmənləri gəlib cəhənnəmə yetişdilər, o vaxt Allah-Təala onların əzalarından şəhadət alar, onların qulaqları və gözləri və cildləri onların əməllərinə şəhadət edər*.**

*(*Qeyd: "Qiyamət günündə əzaların danışıb, şəhadət etməsi Allah-Təalanın asilərin əməllərini onlara göstərməkdən ibarətdir. Onlar özləri o əməllərin meydana gəlməsini elə iqrar edərlər ki, sanki əzaları şəhadət edib, daha onların inkar etməyə imkanları qalmır).*

**21) (وَقَالُوا لِجُلُودِهِمْ لِمَ شَهِدْتُمْ عَلَيْنَا) - Onlar cildlərinə deyərlər: "Nədən ötrü bizim zərərimizə şəhadət edib, bizi rüsvay etdiniz?**

قَالُوٓا اَنْطَقَنَا اللّٰهُ الَّذِيٓ اَنْطَقَ كُلَّ شَيْءٍ وَهُوَ خَلَقَكُمْ اَوَّلَ مَرَّةٍ وَاِلَيْهِ تُرْجَعُونَ ﴿٢١﴾ وَمَا كُنْتُمْ
تَسْتَتِرُونَ اَنْ يَشْهَدَ عَلَيْكُمْ سَمْعُكُمْ وَلَا اَبْصَارُكُمْ وَلَا جُلُودُكُمْ وَلٰكِنْ ظَنَنْتُمْ اَنَّ اللّٰهَ لَا يَعْلَمُ كَثِيرًا
مِمَّا تَعْمَلُونَ ﴿٢٢﴾ وَذٰلِكُمْ ظَنُّكُمُ الَّذِي ظَنَنْتُمْ بِرَبِّكُمْ اَرْدٰيكُمْ فَاَصْبَحْتُمْ مِنَ الْخَاسِرِينَ ﴿٢٣﴾
فَاِنْ يَصْبِرُوا فَالنَّارُ مَثْوًى لَهُمْ وَاِنْ يَسْتَعْتِبُوا فَمَا هُمْ مِنَ الْمُعْتَبِينَ ﴿٢٤﴾ وَقَيَّضْنَا لَهُمْ قُرَنَٓاءَ فَزَيَّنُوا
لَهُمْ مَا بَيْنَ اَيْدِيهِمْ وَمَا خَلْفَهُمْ وَحَقَّ عَلَيْهِمُ الْقَوْلُ فِيٓ اُمَمٍ قَدْ خَلَتْ مِنْ قَبْلِهِمْ مِنَ الْجِنِّ وَالْاِنْسِ
اِنَّهُمْ كَانُوا خَاسِرِينَ ﴿٢٥﴾

---

(قَالُوٓا اَنْطَقَنَا اللّٰهُ الَّذِيٓ اَنْطَقَ كُلَّ شَيْءٍ) - **Cildləri onlara cavab verib deyərlər: “Biz öz ixtiyarımızla danışıb, şəhadət etmədik. Hər bir şeyə nitq gücü verib danışdıran Allah-Təala bizə də nitq verib danışdırdı.**

(وَهُوَ خَلَقَكُمْ اَوَّلَ مَرَّةٍ وَاِلَيْهِ تُرْجَعُونَ) - **Allah-Təala hər bir şeyə qadirdir, necə ki sizi heç bir şey olmadığınız halda, birinci dəfə yaratdı, indi budur yenə sizə həyat verib, onun tərəfinə qayıdırsınız. Hər bir şeyə qadir olan Allah-Təala bizi də danışdırmağa qadirdir”.**

**22)** (وَمَا كُنْتُمْ تَسْتَتِرُونَ اَنْ يَشْهَدَ عَلَيْكُمْ سَمْعُكُمْ وَلَا اَبْصَارُكُمْ وَلَا جُلُودُكُمْ) - (Ey Məhəmməd), **o vaxt asilərə deyilər: “Siz ki dünyada hər bir çirkin əməl edəndə, onları ona görə gizlətmirdiniz ki, əzalarınızın-qulaqlarınızın, gözlərinizin və cildlərinizin qiyamət günündə sizin əleyhinizə şəhadət edəcəyindən qorxurdunuz, çünki siz qiyaməti inkar edib, Allah-Təalanın əzaları danışdırmaq qüdrətinə inanmırdınız.** (وَلٰكِنْ ظَنَنْتُمْ اَنَّ اللّٰهَ لَا يَعْلَمُ كَثِيرًا مِمَّا تَعْمَلُونَ) - **Əksinə, gizlincə çirkin əməllər edəndə zənn edirdiniz ki, Allah-Təala etdiyiniz əməllərin çoxuna** (gizli olanlara) **agah olmaz. O cəhətə görə gizlədirdiniz.**

**23)** (وَذٰلِكُمْ ظَنُّكُمُ الَّذِي ظَنَنْتُمْ بِرَبِّكُمْ اَرْدٰيكُمْ فَاَصْبَحْتُمْ مِنَ الْخَاسِرِينَ) - **Szin bu tənəniz ki, rəbbiniz Allah-Təalaya etdiniz, hansı ki, guya məxfilərə agah olmaz, budur sizi fəlakətə salıb, öz nəfslərinizə ziyan edənlərdən oldunuz.**

**24)** (فَاِنْ يَصْبِرُوا فَالنَّارُ مَثْوًى لَهُمْ) - (Ey Məhəmməd), **əgər asilər qiyamətdə səbir edib dursalar, səbir etmək onlara bir fayda verməyib, məqamları cəhənnəm odu olar, oradan xilas olmayacaqlar.**

(وَاِنْ يَسْتَعْتِبُوا فَمَا هُمْ مِنَ الْمُعْتَبِينَ) - **Ya da ki, əgər sevdikləri** (dünya) **tərəfinə qayıtmağı istəsələr də, onlara cavab verilməyib qayıtmağa izin verilməyəcəkdir. Hər bir halda əzab içində olacaqlar.**

**25)** (وَقَيَّضْنَا لَهُمْ قُرَنَٓاءَ فَزَيَّنُوا لَهُمْ مَا بَيْنَ اَيْدِيهِمْ وَمَا خَلْفَهُمْ) - (Ey Məhəmməd), **müşriklər ki, sənə itaət etməyib iman etmirlər, (onların xəbis təbiətlərinə görə) onlardan ötrü elə şeytansifət yoldaşlar təyin etdik ki, onların əvvəlki və sonra etmək istədikləri əməllərinə zinət verib, iman etmələrinə mane olarlar.** (وَحَقَّ عَلَيْهِمُ الْقَوْلُ فِيٓ اُمَمٍ قَدْ خَلَتْ مِنْ قَبْلِهِمْ مِنَ الْجِنِّ وَالْاِنْسِ اِنَّهُمْ كَانُوا خَاسِرِينَ)

وَقَالَ الَّذِينَ كَفَرُوا لَا تَسْمَعُوا لِهٰذَا الْقُرْاٰنِ وَالْغَوْا فِيهِ لَعَلَّكُمْ تَغْلِبُونَ ﴿٢٦﴾ فَلَنُذِيقَنَّ الَّذِينَ كَفَرُوا
عَذَابًا شَدِيدًا وَلَنَجْزِيَنَّهُمْ اَسْوَاَ الَّذِي كَانُوا يَعْمَلُونَ﴿٢٧﴾ ذٰلِكَ جَزَٓاءُ اَعْدَٓاءِ اللّٰهِ النَّارُ لَهُمْ فِيهَا دَارُ
الْخُلْدِ جَزَٓاءً بِمَا كَانُوا بِاٰيَاتِنَا يَجْحَدُونَ ﴿٢٨﴾ وَقَالَ الَّذِينَ كَفَرُوا رَبَّنَٓا اَرِنَا الَّذَيْنِ اَضَلَّانَا مِنَ الْجِنِّ
وَالْاِنْسِ نَجْعَلْهُمَا تَحْتَ اَقْدَامِنَا لِيَكُونَا مِنَ الْاَسْفَلِينَ ﴿٢٩﴾ اِنَّ الَّذِينَ قَالُوا رَبُّنَا اللّٰهُ ثُمَّ اسْتَقَامُوا

---

- (Ey Məhəmməd), **həqiqətən, bu müşriklər öz nəfslərinə qarşı ziyankar olduqlarına görə onlardan əvvəl əzab edilən cin və insanlardan ibarət ümmətlərə olduğu kimi, onlara da bizim əzabımız layiq oldu.** (Qüreyş camaatı bir-birinə vəsiyyət edib deyirdilər: "Məhəmməd (Quran) oxuyanda, siz ucadan səslənib xurafat və mənasız sözlər danışın, ta ki, Məhəmmədin Quran oxumasına mane olasınız. Bu barədə sıradakı ayə nazil oldu).

**26) (وَقَالَ الَّذِينَ كَفَرُوا لَا تَسْمَعُوا لِهٰذَا الْقُرْاٰنِ وَالْغَوْا فِيهِ لَعَلَّكُمْ تَغْلِبُونَ) -** (Ey Məhəmməd), **sən Quran oxuyanda kafirlər bir- birlərinə dedilər: "Bu Qurana qulaq asmayın, oxu əsnasında boş, batil sözlərlə qarışıqlıq salın, bəlkə o səbəbə Məhəmmədə qalib gəlib, Quranı batil edəsiniz.**

**27) (فَلَنُذِيقَنَّ الَّذِينَ كَفَرُوا عَذَابًا شَدِيدًا) -** (Ey Məhəmməd), **kafirlər səninlə belə ki, rəftar edirlər, əlbəttə onlara şiddətli əzabı dadızdırıb, cəhənnəm əzabına düçar edəcəyik. (وَلَنَجْزِيَنَّهُمْ اَسْوَاَ الَّذِي كَانُوا يَعْمَلُونَ) - Əlbəttə, axirətdə çirkin əməllərinə cəza olaraq, onlara böyük əzab verərik.**

**28) (ذٰلِكَ جَزَٓاءُ اَعْدَٓاءِ اللّٰهِ النَّارُ) - Bu şiddətli cəza Allah Təalanın düşmənlərinin cəzasıdır və o da od əzabıdır. (لَهُمْ فِيهَا دَارُ الْخُلْدِ جَزَٓاءً بِمَا كَانُوا بِاٰيَاتِنَا يَجْحَدُونَ) -** (Ey Məhəmməd), **onlardan ötrü həmin odun içində həmişəlik ev, mənzil vardır. Bizim ayələrimizi inkar etməyə görə onlara cəza olaraq həmişəlik od əzabını verərik.**

**29)(وَقَالَ الَّذِينَ كَفَرُوا رَبَّنَٓا اَرِنَا الَّذَيْنِ اَضَلَّانَا مِنَ الْجِنِّ وَالْاِنْسِ نَجْعَلْهُمَا تَحْتَ اَقْدَامِنَا لِيَكُونَا مِنَ الْاَسْفَلِينَ) -** (Ey Məhəmməd), **cəhənnəmdə kafirlər deyərlər: "Ey bizim rəbbimiz, cin və insan şeytanlarını - hansı ki, bizi zəlalətə saldılar və belə əzaba layiq olduq, bizə göstər ki, onları tutub bu odun içində ayaqlarımızın altına qoyaq. Belə ki, əzabda bizdən aşağı mərtəbədə olsunlar. Onlar ki, bizi zəlalətə saldılar, gərək onlara bizdən artıq əzab edilməsini müşahidə edək.** (Allah-Təala bu ayədə onlara cavab vermir, çünki əlahiddə ayədə cavab verib buyurubdur: "Zəlalətə salanlarla düşənlərin əzabında bir fərq yoxdur. Hamınıza ağıl vermişəm, siz ağlın hökmünü tərk edib, nəfsin istəklərinə tabe olmaqla rəislərin sözlərinə itaət edib, zəlalətə vaqe oldunuz. Sizə də onlar kimi əzab olunacaqdır").

**30) (اِنَّ الَّذِينَ قَالُوا رَبُّنَا اللّٰهُ ثُمَّ اسْتَقَامُوا) -** (Ey Məhəmməd), **həqiqətən, o şəxslər ki, tövhidə inanıb dedilər: "Bizim rəbbimiz yeganə Allah-Təaladır. Ondan sonra həmin sözlərində möhkəm və sabit durub, haqdan batil tərəfinə**

تَتَنَزَّلُ عَلَيْهِمُ الْمَلٰئِكَةُ اَلَّا تَخَافُوا وَلَا تَحْزَنُوا وَاَبْشِرُوا بِالْجَنَّةِ الَّتِي كُنْتُمْ تُوعَدُونَ ﴿٣٠﴾ نَحْنُ
اَوْلِيَآؤُكُمْ فِي الْحَيٰوةِ الدُّنْيَا وَفِي الْاٰخِرَةِۚ وَلَكُمْ فِيهَا مَا تَشْتَهِيَ اَنْفُسُكُمْ وَلَكُمْ فِيهَا مَا تَدَّعُونَۜ ﴿٣١﴾
نُزُلًا مِنْ غَفُورٍ رَحِيمٍ ﴿٣٢﴾ وَمَنْ اَحْسَنُ قَوْلًا مِمَّنْ دَعَآ اِلَى اللّٰهِ وَعَمِلَ صَالِحًا وَقَالَ اِنَّنِي مِنَ
الْمُسْلِمِينَ﴿٣٣﴾ وَلَا تَسْتَوِي الْحَسَنَةُ وَلَا السَّيِّئَةُۜ اِدْفَعْ بِالَّتِي هِيَ اَحْسَنُ

---

**meyl etmədilər. (تَتَنَزَّلُ عَلَيْهِمُ الْمَلٰئِكَةُ اَلَّا تَخَافُوا وَلَا تَحْزَنُوا وَاَبْشِرُوا بِالْجَنَّةِ الَّتِي كُنْتُمْ تُوعَدُونَ) - Belə şəxslərə qiyamət günündə məlaikə gəlib deyər: "Bu günkü gündə qorxub üzülməyin, o cənnət ki Allah-Təala peyğəmbərlərinin dili ilə sizə dünyada vəd edirdi, o cənnətə daxil olmaqla müjdələnin.**

**31) (نَحْنُ اَوْلِيَآؤُكُمْ فِي الْحَيٰوةِ الدُّنْيَا وَفِي الْاٰخِرَةِ) - Dünyada və axirətdə sizin dostlarınız bizik. (لَكُمْ فِيهَا مَا تَشْتَهِيَ اَنْفُسُكُمْ وَلَكُمْ فِيهَا مَا تَدَّعُونَ) - Hər bir şey ki, nəfsiniz istəyir və hər bir şeyi ki, xahiş və arzu edirsiniz, sizdən ötrü cənnətdə hazırdır. (نُزُلًا مِنْ غَفُورٍ رَحِيمٍ) - Cənnətin nemətləri rəhm edib bağışlayan Allah-Təala tərəfindən sizdən ötrü tədarük edilən şeylərdir, sizin üçün hamısı hazır edilibdir."**

**32) (وَمَنْ اَحْسَنُ قَوْلًا مِمَّنْ دَعَآ اِلَى اللّٰهِ وَعَمِلَ صَالِحًا وَقَالَ اِنَّنِي مِنَ الْمُسْلِمِينَ) -** (Ey Məhəmməd), **bir şəxs ki, danışıb, xalqı şirkdən tövhidə, zəlalətdən hidayətə, küfrdən imana dəvət edib, özü də xeyir əməl edib deyə ki, mən özüm də islam dinində sabit və bərqərar olanlardanam, bəs belə şəxsdən* daha gözəl danışan kimdir?**

*(*Qeyd: "Əlbəttə belə danışan şəxsdən gözəl danışan olmaz, yəni gərək mömin şəxs bu sifətdə olsun. İslam dininə inananlarən şüarı zəlalətdə olanları hidayətə çağırıb, özgə batil dinlərdən islama dəvət etmək olmalıdır. Əgər müsəlmanların hamısı bu sifətdə olmasalar da, lakin Qurani-Şərifin hökmünə görə gərək müsəlmanlardan bir qrup olsun ki, iş və əməlləri xalqı hidayət etmək olub, gərək islam dininə dəvət etməyi özlərinə vacib saysınlar. İslam ümməti yuxarıdan aşağıya kimi necə də Qurani-Şərifin bir çox ayəsindən qafil olublar? Belə bir uca ayənin faydalı mənası gizli qalıb, onlara əməl olunmur. Bəs Qurani-Şərifə bundan böyük zülm olarmı? Ayənin məzmunu digər millətlər arasında rəvac tapıb, ondan böyük faydalar qazanırlar, lakin islam milləti böyük bədbəxtliyə düçar olub, Qurani-Şərifin gözəlliyə və mədəniyyətə işarə edən açıq-aydın ayələrinə lazımsız mənalar yükləyib, Allah-Təalanın möcüzəli kəlamını faydasız elan ediblər. Bundan artıq cəhalət olarmı? Ayənin incəliklərindən xülasə şəklində bəhs edib, təfsilatını doğru nəzər sahiblərinin ağlına həvalə etdim).*

**33-34) (وَلَا تَسْتَوِي الْحَسَنَةُ وَلَا السَّيِّئَةُۜ اِدْفَعْ بِالَّتِي هِيَ اَحْسَنُ) -** (Ey Məhəmməd), **yaxşı və pis, əlbəttə, bir-birindən fərqli olub, eyni olmazlar. Lakin bir yaxşı var, bir də lap yaxşı, bir şəxsdən sənə bir pislik gələndə, o pisliyə əvəz verməyib, onun müqabilində nəinki yaxşı, bəlkə ən yaxşı* ilə o pisliyi dəf**

فَاِذَا الَّذِي بَيْنَكَ وَبَيْنَهُ عَدَاوَةٌ كَاَنَّهُ وَلِيٌّ حَمِيمٌ ﴿٣٤﴾ وَمَا يُلَقّٰيهَٓا اِلَّا الَّذٖينَ صَبَرُواۚ وَمَا يُلَقّٰيهَٓا اِلَّا ذُو حَظٍّ عَظٖيمٍ ﴿٣٥﴾ وَاِمَّا يَنْزَغَنَّكَ مِنَ الشَّيْطَانِ نَزْغٌ فَاسْتَعِذْ بِاللّٰهِۜ اِنَّهُ هُوَ السَّمٖيعُ الْعَلٖيمُ ﴿٣٦﴾ وَمِنْ اٰيَاتِهِ الَّيْلُ وَالنَّهَارُ وَالشَّمْسُ وَالْقَمَرُۜ لَا تَسْجُدُوا لِلشَّمْسِ وَلَا لِلْقَمَرِ وَاسْجُدُوا لِلّٰهِ الَّذٖي خَلَقَهُنَّ اِنْ كُنْتُمْ اِيَّاهُ تَعْبُدُونَ ﴿٣٧﴾

---

**et.** (فَاِذَا الَّذِي بَيْنَكَ وَبَيْنَهُ عَدَاوَةٌ كَاَنَّهُ وَلِيٌّ حَمِيمٌ) **- O vaxt o yaxşılıq səbəbinə baxıb görərsən, o şəxs ki səninlə onun arasında ədavət var idi, çevrilib sanki sənə yaxın dost kimi olar.**

*(*Qeyd: "Əfv edib pisliyi bağışlamaq islam dininin ilk hökmlərindəndir. Necə ki, ayədə buyurur: "Pislik müqabilində yaxşılıq et, məsələn, bir kişi sənə pislik etsə, onu bağışlamaq yaxşıdır. Amma ən yaxşısı odur ki, bağışlamaqdan əlavə ona bir yaxşılıq da edəsən. Əgər səni məzəmmət etmiş olsa, sən onu mədh edəsən. Ya da ki sənin əziz övladını qətl etmiş olsa, onun övladını qətldən xilas edəsən. Ya da ki sənin malını tələf eləmiş olsa, sən onun malını mühafizə edəsən. Bu, Allahın razı olduğu əxlaq olub, islamın da əsl qanunudur ki, Qurani-Şərifdə həmişə qeyd olunur. Əfv etmək nə böyük sifətdir. İctimailəşməyə və mədəniləşməyə nə böyük dəlildir. Belə bir uca əmr islam ümmətinin arasında necə hökmsüz qalıb, səbəbi məlum deyildir. Onun əvəzinə çirkin əməllər olan vəhşilik və oğurluq peyda olub. Guya Qurani-Şərif onların arasında əbədiyyən oxunmur. Necə yəni oxunmur, halbuki biz görürük ki, müsəlmanlardan bir şəxs vəfat edəndə, Quran" oxuyanlar meyitin ruhunun şad olması üçün növbə ilə avazla Quran oxuyarlar. Bəs bu oxunanlar Quran deyilmi? Bəli, bəli. Həmin fasiqlərin avazla Quran oxumasından başqa müsəlmanlar arasında bir şey qalmayıbdır. Qurani-Şərifin ehkamı hökmsüz olub, Allah qorusun, şeir kitabı kimi bir kitab olubdur. (Allahım, bizə fərəh və rahatlıq ver!)*

**35)** (وَمَا يُلَقّٰيهَٓا اِلَّا الَّذٖينَ صَبَرُواۚ وَمَا يُلَقّٰيهَٓا اِلَّا ذُو حَظٍّ عَظٖيمٍ) **- Bu gözəl işi** (pisliyin müqabilində yaxşılıq etmək) **ancaq çirkin və iyrənc əməllərə səbir edib, xeyir əməldən pay sahibi olan şəxslər edər, belə bir sifətə sahib olmaq hər bir şəxsin hünəri deyildir.**

**36)** (وَاِمَّا يَنْزَغَنَّكَ مِنَ الشَّيْطَانِ نَزْغٌ فَاسْتَعِذْ بِاللّٰهِۜ اِنَّهُ هُوَ السَّمٖيعُ الْعَلٖيمُ) - (Ey Məhəmməd), **əgər şeytandan** (şəri əmr edən xəbis nəfsdən) **sənə bir məkr, hiylə və vəsvəsə gəlib, səni bəhs olunan xeyir əməldən yayındırsa, o vaxt şeytandan Allah-Təalaya pənah aparıb, o vəsvəsəyə etina etməyib, həmin xeyir əmələ davam et. Həqiqətən, Allah-Təala sənin pənah aparmağını eşidib, hər bir əhvalından agahdır, səni şeytanın şərindən mühafizə edər.** (Bir camaat günəşə, aya səcdə eldirdilər, növbəti ayədə günəş və ayın Allah-Təalanın məxluqu olduğu və Allah-Təalanın tövhidinə işarə edən açıq sübutlar olduğu bəyan olunub, onlara ibadət etmək qadağan olunur).

**37)** (وَمِنْ اٰيَاتِهِ الَّيْلُ وَالنَّهَارُ وَالشَّمْسُ وَالْقَمَرُ) - (Ey Məhəmməd), **günəşə və aya sitayiş edib, səcdə edənlərə de: "Gecə və gündüz və onların bir-birindən aralanıb, xüsusi adla adlanmasına işarə edən günəş və ay Allah-Təalanın**

فَاِنِ اسْتَكْبَرُوا فَالَّذِينَ عِنْدَ رَبِّكَ يُسَبِّحُونَ لَهُ بِالَّيْلِ وَالنَّهَارِ وَهُمْ لَا يَسْـَٔمُونَ ﴿٣٨﴾ وَمِنْ اٰيَاتِهٖٓ اَنَّكَ
تَرَى الْاَرْضَ خَاشِعَةً فَاِذَآ اَنْزَلْنَا عَلَيْهَا الْمَٓاءَ اهْتَزَّتْ وَرَبَتْۜ اِنَّ الَّذٖٓي اَحْيَاهَا لَمُحْيِ الْمَوْتٰىۜ اِنَّهُ عَلٰى
كُلِّ شَيْءٍ قَدٖيرٌ ﴿٣٩﴾ اِنَّ الَّذٖينَ يُلْحِدُونَ فٖٓي اٰيَاتِنَا لَا يَخْفَوْنَ عَلَيْنَاۜ اَفَمَنْ يُلْقٰى فِي النَّارِ خَيْرٌ اَمْ مَنْ
يَأْتٖٓي اٰمِنًا يَوْمَ الْقِيٰمَةِۜ اِعْمَلُوا مَا شِئْتُمْۙ اِنَّهُ بِمَا تَعْمَلُونَ بَصٖيرٌ ﴿٤٠﴾

---

**tövhidinə işarə edən dəlil və sübutlardandır. Onlara sitayiş edib səcdə etmək yanlışdır. (لَا تَسْجُدُوا لِلشَّمْسِ وَلَا لِلْقَمَرِ وَاسْجُدُوا لِلّٰهِ الَّذٖي خَلَقَهُنَّ اِنْ كُنْتُمْ اِيَّاهُ تَعْبُدُونَ) - Günəşə və aya səcdə etməyin, əgər yeganə Allah-Təalaya ibadət edənsizsə, ona səcdə edin. Hansı ki, gecəni, gündüzü, günəşi və ayı o yaradıbdır. Yaradıcını tərk edib, məxluqa səcdə etməyin.**

**38)** (فَاِنِ اسْتَكْبَرُوا فَالَّذِينَ عِنْدَ رَبِّكَ يُسَبِّحُونَ لَهُ بِالَّيْلِ وَالنَّهَارِ وَهُمْ لَا يَسْـَٔمُونَ) - (Ey Məhəmməd), **əgər müşriklər təkəbbürlənib, müvəhhid olmayıb, şirklərində qalsalar, onları tərk edib, üz çevir, Allah-Təalaya səcdə edib, ibadət edənlər vardır, o şəxslər** (möminlər) **ki, Allah-Təalanın yanında hörmətləri və yaxın dərəcələri vardır, gecə-gündüz Allah-Təalanı pak və müqəddəs saymaqdan bezib usanmazlar.**

**39)** (وَمِنْ اٰيَاتِهٖٓ اَنَّكَ تَرَى الْاَرْضَ خَاشِعَةً) - (Ey Məhəmməd), **Allah-Təalanın tövhid və qüdrətinə işarə edən dəlil və sübutlardan biri də budur ki, həqiqətən, sən həmin bu yeri zəlil, qurumuş, ot-ələfsiz elə bir halda görərsən ki, onda heç bir bitki bitmir.** (فَاِذَآ اَنْزَلْنَا عَلَيْهَا الْمَٓاءَ اهْتَزَّتْ وَرَبَتْ) **- O zaman ki, yerə yağış göndərdik, yağışın səbəbinə yer qabarıb, hərəkətə gəlib, hər bir növ bitki ondan çıxmaqla zinət tapıb,** (təkəbbürlü şəxslərin libasları ilə fəxr etməsi kimi) **yer də öz libası ilə fəxr edər.** (Ey Məhəmməd), **yeri öləndən sonra dirilib, təzədən ona həyat verilməsini gördünmü?** (اِنَّ الَّذٖٓي اَحْيَاهَا لَمُحْيِ الْمَوْتٰى) (اِنَّهُ عَلٰى كُلِّ شَيْءٍ قَدٖيرٌ) **- Həqiqətən, yerə öləndən sonra həyat verib diriləndən Allah-Təala hər bir şeyə qadirdir.**

**40)** (اِنَّ الَّذٖينَ يُلْحِدُونَ فٖٓي اٰيَاتِنَا لَا يَخْفَوْنَ عَلَيْنَاۜ) - (Ey Məhəmməd), **həqiqətən, o şəxslər ki, bizim qüdrət və tövhidimizə işarə edən dəlil və sübutlarımızın haqqında batil tərəfinə meyil edib, onlara tənə edib, öz xəyalları ila hər birinin haqqında özlərindən bir şey düzəldib deyirlər, - necə ki, materialistlər günəşin və ayın və ulduzların haqqında deyirlər, onlar bizə məxfi deyildir. Onları öz dedikləri sözlərinin cəzasına çatdırıb, əzab edib cəhənnəmə salacağam.** (اَفَمَنْ يُلْقٰى فِي النَّارِ خَيْرٌ اَمْ مَنْ يَأْتٖٓي اٰمِنًا يَوْمَ الْقِيٰمَةِۜ) **- Bəs cəhənnəm oduna atılıb əzab olunan şəxs yaxşıdır, ya o şəxs ki qiyamət günündə hər bir qorxudan xatircəm olduğu halda məhşərə varid ola? Əlbəttə, xatircəm olan şəxs yaxşı olacaqdır. Bəs nə cəhətə görə müşriklər müvəhhid olmurlar ki, xatircəm olsunlar?** (اِعْمَلُوا مَا شِئْتُمْۙ اِنَّهُ بِمَا تَعْمَلُونَ بَصٖيرٌ) **- Ey müşriklər, nə istəyirsiniz edin, həqiqətən, Allah-Təala sizin əməllərinizi görüb onlara cəza verəcəkdir.**

اِنَّ الَّذِينَ كَفَرُوا بِالذِّكْرِ لَمَّا جَٓاءَهُمْۚ وَاِنَّهُ لَكِتَابٌ عَزِيزٌۙ ﴿٤١﴾ لَا يَأْتِيهِ الْبَاطِلُ مِنْ بَيْنِ يَدَيْهِ وَلَا مِنْ خَلْفِهِۜ تَنْزِيلٌ مِنْ حَكِيمٍ حَمِيدٍ ﴿٤٢﴾ مَا يُقَالُ لَكَ اِلَّا مَا قَدْ قِيلَ لِلرُّسُلِ مِنْ قَبْلِكَۜ اِنَّ رَبَّكَ لَذُو مَغْفِرَةٍ وَذُو عِقَابٍ اَلِيمٍ﴿٤٣﴾

---

**41)** (اِنَّ الَّذِينَ كَفَرُوا بِالذِّكْرِ لَمَّا جَٓاءَهُمْ) - (Ey Məhəmməd), **həqiqətən, o şəxslər ki, Quran onlara gələn vaxt tənə edib, Qurana kafir oldular, bizim əzabımız onları tutub, xilas olmayacaqlar.** (وَاِنَّهُ لَكِتَابٌ عَزِيزٌ) **- Və həqiqətən, Quran batil kitablara qalib olan, uca mərtəbədə və Allah-Təalanın himayəsində olan bir kitabdır.** (Növbəti ayə bu ayənin təfsiridir).

**42)** (لَا يَأْتِيهِ الْبَاطِلُ مِنْ بَيْنِ يَدَيْهِ وَلَا مِنْ خَلْفِهِۜ) **- Quranın nə əvvəl nə son tərəfinə batil* gəlməyib, ona heç bir əlavə edə bilməzlər ki, onun ayələrinə artıq-əskik qatsınlar.**

*(*Qeyd: "Bu ayə və bundan başqa olan ayələr Qurani-Şərifdə artıq-əskik olmamasına açıq dəlil və möhkəm sübutdur. Bu Quran ki indi biz müsəlmanların əlindədir, əvvəldən axıra kimi Allah-Təaladan gələn kəlamdır, nə bir hərfi əskilmiş, nə bir hərf əlavə olunmuşdur. Uca peyğəmbər (ə.s) özü onu cəm və tərtib edib, necə ki, indi mövcuddur. Həmin halət ilə bizə tapşırıb, dünyadan köçübdür. Onda artıq-əskik olmasına inanmaq Quranı inkar etmək, islamı yıxmaq deməkdir. İslam dininin binası həmin Qurani-Şəriflə möhkəmlənmişdir. Onda artıq-əskik olarsa, etibardan düşüb, mötəbər olmayan kitab hökmündə olar. O halda belə bir böyük və möhkəm dinin binasını onunla möhkəmlətmək çox çətin bir iş olar. İslam ümmətindən bir qrupun Quranda artıq-əskik olmasına inanması, hətta o haqda danışması onlara ar olsun!)*

(تَنْزِيلٌ مِنْ حَكِيمٍ حَمِيدٍ) **- Hər bir feilində hikmət sahibi olan və bəyənilmiş Allah-Təaladan bu Quran nazil olubdur. Ona artıq-əskik qatmağa heç bir şəxs qadir deyildir.**

**43)** (مَا يُقَالُ لَكَ اِلَّا مَا قَدْ قِيلَ لِلرُّسُلِ مِنْ قَبْلِكَ) - (Ey Məhəmməd), **bu müşriklərin sənə tənə edib, əziyyət etmələrindən sıxılma, bu sözlər ki, sənə deyilir, həmin sözlərin eynisi səndən əvvəlki peyğəmbərlərə də deyilibdir. Necə ki, onlar səbir ediblər, sən də səbir et.** (اِنَّ رَبَّكَ لَذُو مَغْفِرَةٍ وَذُو عِقَابٍ اَلِيمٍ) **-** (Ey Məhəmməd), **həqiqətən, sənin rəbbin Allah-Təala tövbə edənləri bağışlayıb küfr və inadlarında qalanlara əziyyətli əzab edəndir.** (Əgər müşriklər də tövbə edib iman etsələr, Allah-Təala onları bağışlayacaqdır və əgər küfrlərində qalsalar, hər halda onlara əzab edəcəkdir).

**44)** (وَلَوْ جَعَلْنَاهُ قُرْاٰنًا اَعْجَمِيًّا لَقَالُوا لَوْلَا فُصِّلَتْ اٰيَاتُهُۜ ءَاَعْجَمِيٌّ وَعَرَبِيٌّ) - (Ey Məhəmməd), **mən bu Quranı sənə ərəb dilində göndərdim, necə ki, hər bir peyğəmbərə öz xalqının dilində kitab göndərmişəm, sənin xalqın ərəb olduğuna görə**

وَلَوْ جَعَلْنَاهُ قُرْاٰنًا اَعْجَمِيًّا لَقَالُوا لَوْلَا فُصِّلَتْ اٰيَاتُهُ ۜ ءَاَعْجَمِيٌّ وَعَرَبِيٌّ ۜ قُلْ هُوَ لِلَّذِينَ اٰمَنُوا هُدًى
وَشِفَاۤءٌ ۜ وَالَّذِينَ لَا يُؤْمِنُونَ فِيٓ اٰذَانِهِمْ وَقْرٌ وَهُوَ عَلَيْهِمْ عَمًى ۜ اُولٰۤئِكَ يُنَادَوْنَ مِنْ مَكَانٍ بَعِيدٍ
﴿٤٤﴾ وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْكِتَابَ فَاخْتُلِفَ فِيهِ ۜ وَلَوْلَا كَلِمَةٌ سَبَقَتْ مِنْ رَبِّكَ لَقُضِيَ بَيْنَهُمْ ۜ وَاِنَّهُمْ
لَفِي شَكٍّ مِنْهُ مُرِيبٍ ﴿٤٥﴾

---

**gərək onun həqiqətini dərk edib iman edəydilər. Bununla belə iman etmədilər, əgər bu Quranı əcəm* dilində göndər.səydik, yenə də inkar edib deyərdilər: "Nədən ötrü bu Quranın ayələri elə bir dildə bəyan olunmayıb ki, biz onu anlayaq. Bu necə olur ki, biz özümüz ərəb olaq, kitabımız əcəm dilində nazil olsun. Belə kitaba iman etmərik.** (Ey Məhəmməd), **müşriklər bəhanə axtarırlar, hər hansı bir dildə onlara kitab gəlsə, iman edən deyildirlər.**

*(*Qeyd: "Ərəblər özlərindən başqa yer üzündə olan başqa xalqların hamısına əcəm deyirlər).*

**(قُلْ هُوَ لِلَّذِينَ اٰمَنُوا هُدًى وَشِفَاۤءٌ) -** (Ey Məhəmməd), **müşriklərə de ki, o şəxslər ki, Qurana iman ediblər, Quran onlardan ötrü haqq tərəfinə hidayət və** (cəhalət xəstəliyindən) **şəfadır. (وَالَّذِينَ لَا يُؤْمِنُونَ فِيٓ اٰذَانِهِمْ وَقْرٌ وَهُوَ عَلَيْهِمْ عَمًى) - Və o şəxslər ki, Qurana iman etməyiblər, onların qulaqlarında haqq sözü eşitməyə mane olan ağırlıq vardır və Quran onlara görünmür. Quranı görməyə gözləri yoxdur. (Günəş yarasanın gözünü kor edən kimi guya Quran da onların gözlərini kor edir, (اُولٰۤئِكَ يُنَادَوْنَ مِنْ مَكَانٍ بَعِيدٍ) - Qurana iman etməyənlər guya elə bir uzaq yerdən onları çağırırlar ki, o çağıranın səsini eşitmirlər.** (Necə ki, uzaqdan çağırılan şəxs çağıranın səsini eşidib anlamaz, habelə Qurana iman etməyən inadkarlar da Qurandan heç bir şey anlamazlar).

**45) (وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْكِتَابَ فَاخْتُلِفَ فِيهِ) -** (Ey Məhəmməd), **təkcə sənə verilən Quran haqqında ixtilaf etməyiblər, səndən əvvəl verilən kitablar haqqında da ixtilaf ediblər. Həqiqətən, Musaya Tövratı verdik, onda ixtilaf edib, bəzisi iman edib, bəziləri iman etmədilər. (وَلَوْلَا كَلِمَةٌ سَبَقَتْ مِنْ رَبِّكَ لَقُضِيَ بَيْنَهُمْ) -** (Ey Məhəmməd), **əgər sənin rəbbin Allah-Təaladan hökm gəlməsəydi ki, Quranı təkzib edənlərin əzabını qiyamətə qədər təxirə salıb, orada cəza verəcəm, əlbəttə, tezliklə onların arasında əzaba hökm olunub, hamısını həlak edərdim. (وَاِنَّهُمْ لَفِي شَكٍّ مِنْهُ مُرِيبٍ) - Həqiqətən, müşriklər özləri Quranın haqqında şübhədə olub, özgələrini də şəkkə salırlar, belə inadkar şəxslərə son dərəcə ağır əzab verəcəyəm.**

**46) (مَنْ عَمِلَ صَالِحًا فَلِنَفْسِهِ) - Kim ki, xeyir əməl etsə, onun faydası o şəxsin öz nəfsinin xeyrinə aid olar, (وَمَنْ اَسَاۤءَ فَعَلَيْهَا) Və kim ki, şər əməl etsə, onun günahının əzabı o şəxsin öz nəfsinin zərərinə aid olar. (وَمَا رَبُّكَ بِظَلَّامٍ لِلْعَبِيدِ) -**

مَنْ عَمِلَ صَالِحًا فَلِنَفْسِهِ وَمَنْ اَسَآءَ فَعَلَيْهَاۜ وَمَا رَبُّكَ بِظَلَّامٍ لِلْعَبِيدِ ﴿٤٦﴾ اِلَيْهِ يُرَدُّ عِلْمُ السَّاعَةِۜ
وَمَا تَخْرُجُ مِنْ ثَمَرَاتٍ مِنْ اَكْمَامِهَا وَمَا تَحْمِلُ مِنْ اُنْثٰى وَلَا تَضَعُ اِلَّا بِعِلْمِهِۜ وَيَوْمَ يُنَادٖيهِمْ اَيْنَ
شُرَكَٓاءٖيۙ قَالُوٓا اٰذَنَّاكَۙ مَا مِنَّا مِنْ شَهٖيدٍۚ ﴿٤٧﴾ وَضَلَّ عَنْهُمْ مَا كَانُوا يَدْعُونَ مِنْ قَبْلُ وَظَنُّوا مَا لَهُمْ
مِنْ مَحٖيصٍ ﴿٤٨﴾ لَا يَسْـَٔمُ الْاِنْسَانُ مِنْ دُعَٓاءِ الْخَيْرِۘ وَاِنْ مَسَّهُ الشَّرُّ فَيَؤُ۫سٌ قَنُوطٌ ﴿٤٩﴾

---

**Hər bir şəxsin öz əməlinin cəzası ona yetişəcəkdir. (Ey Məhəmməd), sənin rəbbin Allah-Təala öz bəndələrinə zülm edən deyildir.**

**47) (اِلَيْهِ يُرَدُّ عِلْمُ السَّاعَةِۜ)** - (Ey Məhəmməd), **o cümlədən qeyb elmlərindən biri də qiyamət gününə agah olmaqdır. O günün elmini Allah-Təalaya həvalə etmək lazımdır, heç bir nəfər Allah-Təaladan başqa o günə agah olmaz. (وَمَا تَخْرُجُ مِنْ ثَمَرَاتٍ مِنْ اَكْمَامِهَا وَمَا تَحْمِلُ مِنْ اُنْثٰى وَلَا تَضَعُ اِلَّا بِعِلْمِهِۜ) - Onun elmi olmadan heç bir meyvə qabığından ayrılmaz və heç bir qadın hamilə olub doğmaz. Ancaq Allah-Təala onların hamısından agahdır. Meyvələrin bitmə xüsusiyyətinə və yetişməyinə və hamiləlik vaxtının tamam olmasına və yaranışdakı qüsur və qüsursuzluğa, hamısına Allah-Təala agahdır.**

**(وَيَوْمَ يُنَادٖيهِمْ اَيْنَ شُرَكَٓاءٖيۙ قَالُوٓا اٰذَنَّاكَۙ مَا مِنَّا مِنْ شَهٖيدٍۚ) Qiyamət günündə Allah-Təala müşrikləri çağırıb deyər: "O şeyləri ki, mənə şərik qoşurdunuz, hanı, bu günkü gündə necə oldular? Müşriklər cavab verib deyərlər: "İlahi, sənə xəbər veririk ki, bu günkü gündə bizim içimizdə o şeyləri sənə şərik qoşmağımıza şəhadət edən yoxdur. Hamımız müvəhhid olub sənin tövhidinə inanırıq.**

**48) (وَضَلَّ عَنْهُمْ مَا كَانُوا يَدْعُونَ مِنْ قَبْلُ)** - (Ey Məhəmməd), **müşriklərin bundan əvvəl dünyada dua və ibadət etdikləri bütləri onlardan qeyb olub, bir fayda vermədi. (وَظَنُّوا مَا لَهُمْ مِنْ مَحٖيصٍ)**

**Qiyamət günündə mütləq bilərlər ki, onlardan ötrü əzabdan qaçıb, xilas olmaq yoxdur. O səbəbdən bütlərə sitayiş etməyi inkar edib, bizim tövhidimizə inanarlar.**

**49) (لَا يَسْـَٔمُ الْاِنْسَانُ مِنْ دُعَٓاءِ الْخَيْرِۘ)** - (Ey Məhəmməd), **insan mal və nemət istəyib, özünə xeyir cəlb etməkdən üzülməz. (وَاِنْ مَسَّهُ الشَّرُّ فَيَؤُ۫سٌ قَنُوطٌ) - Amma elə ki insana yoxsulluq və darlıq yetişdi o vaxt naümid və məyus olar, guya heç bir xeyir ona yetişməyəcəkdir.**

**50) (وَلَئِنْ اَذَقْنَاهُ رَحْمَةً مِنَّا مِنْ بَعْدِ ضَرَّٓاءَ مَسَّتْهُ لَيَقُولَنَّ هٰذَا لٖيۙ)** - (Ey Məhəmməd), **əgər qiyaməti inkar edən şəxsə yoxsulluq və pərişanlıq yetişəndən sonra öz tərəfimizdən ona bir nemət dadızdırsaq, hər halda deyəcəkdir: "Bu nemət mənim haqqımdır, mənə yetişdi və mən ona layiqəm. (وَمَٓا اَظُنُّ السَّاعَةَ قَٓائِمَةً) Mənim gümanım da yoxdur ki, qiyamət günü olub, məhşər olsun.**

وَلَئِنْ اَذَقْنَاهُ رَحْمَةً مِنَّا مِنْ بَعْدِ ضَرَّآءَ مَسَّتْهُ لَيَقُولَنَّ هٰذَا لِي وَمَآ اَظُنُّ السَّاعَةَ قَآئِمَةً وَلَئِنْ رُجِعْتُ
اِلٰى رَبِّي اِنَّ لِي عِنْدَهُ لَلْحُسْنٰى فَلَنُنَبِّئَنَّ الَّذِينَ كَفَرُوا بِمَا عَمِلُوا وَلَنُذِيقَنَّهُمْ مِنْ عَذَابٍ غَلِيظٍ ﴿٥٠﴾
وَاِذَآ اَنْعَمْنَا عَلَى الْاِنْسَانِ اَعْرَضَ وَنَاٰ بِجَانِبِهِ وَاِذَا مَسَّهُ الشَّرُّ فَذُو دُعَآءٍ عَرِيضٍ ﴿٥١﴾ قُلْ اَرَاَيْتُمْ اِنْ
كَانَ مِنْ عِنْدِ اللّٰهِ ثُمَّ كَفَرْتُمْ بِهِ مَنْ اَضَلُّ مِمَّنْ هُوَ فِي شِقَاقٍ بَعِيدٍ ﴿٥٢﴾ سَنُرِيهِمْ اٰيَاتِنَا فِي الْاٰفَاقِ
وَفِيٓ اَنْفُسِهِمْ حَتّٰى يَتَبَيَّنَ لَهُمْ اَنَّهُ الْحَقُّ

---

**(وَلَئِنْ رُجِعْتُ اِلٰى رَبِّي اِنَّ لِي عِنْدَهُ لَلْحُسْنٰى) - Əgər bir ehtimal, qiyamət olub mən rəbbim Allah-Təala tərəfinə qayıtsam, həqiqətən, orada da məndən ötrü Allah-Təalanın yanında yaxşı, gözəl nemətlər və hörmət olar. Necə ki, dünyada vardır.” (فَلَنُنَبِّئَنَّ الَّذِينَ كَفَرُوا بِمَا عَمِلُوا) -** (Ey Məhəmməd), **kafirlər elə xəyal edirlər ki, əgər qiyamət olsa, yenə nemətin yaxşısı onlara yetişər. Yox, onlar yanlış xəyal ediblər. Əksinə o kafirlərə əzaba səbəb olan əməllərinin həqiqətini onlara xəbər verib məlum edərik ki, əməllərinin hamısı bizim yanımızda qeyd olunub. (وَلَنُذِيقَنَّهُمْ مِنْ عَذَابٍ غَلِيظٍ) - O əməllərinə görə, onlara şiddətli əzab dadızdırıb, əzabdan xilas olmazlar. Etiqadlarının əksini onlara yetirib həmişəlik əzaba düçar olurlar.**

**51) (وَاِذَآ اَنْعَمْنَا عَلَى الْاِنْسَانِ اَعْرَضَ وَنَاٰ بِجَانِبِهِ) - İnsanın pis sifətləri vardır, o cümlədən pis sifətlərindən biri budur, o zaman ki, insana mərhəmət və rəhmətimizi aid edib nemət verdik, şükür etmək əvəzinə bizdən üz çevirib, öz nəfsi ilə məşğul olub, təkəbbüründən şükür etməyib, bizi unudar. (وَاِذَا مَسَّهُ الشَّرُّ فَذُو دُعَآءٍ عَرِيضٍ) - Amma o zaman ki, insana bir yoxsulluq və bir zərər yetişdi, o vaxt baxıb görərsən ki həmişə dua etməklə məşğul olub, daha duadan əl çəkmir.**

**52) (قُلْ اَرَاَيْتُمْ اِنْ كَانَ مِنْ عِنْدِ اللّٰهِ ثُمَّ كَفَرْتُمْ بِهِ) -** (Ey Məhəmməd), **müşriklərə de ki, siz ki, bu Quranı təkzib edirsiniz, dəlil və sübut üzrə təkzib etmirsiniz. Əgər bu Quran** (doğrudan da necə ki, deyirəm) **Allah-Təala tərəfindən olmuş olsa, ondan sonra da siz onu təkzib edib kafir olsanız, o vaxt sizin halınız necə olar? (مَنْ اَضَلُّ مِمَّنْ هُوَ فِي شِقَاقٍ بَعِيدٍ) - Əlbəttə, sizin halınız son dərəcə pis olacaqdır, sizin kimi bəla və zillətdə olanlardan daha çox zəlalətdə olan kimdir?**

**53) (سَنُرِيهِمْ اٰيَاتِنَا فِي الْاٰفَاقِ وَفِيٓ اَنْفُسِهِمْ حَتّٰى يَتَبَيَّنَ لَهُمْ اَنَّهُ الْحَقُّ) -** (Ey Məhəmməd), **dünyanın* hər bir tərəfində** (şərqdə və qərbdə və xüsusən bu ərəblərin özlərinin yaşadığı ərəb yarımadasında) **sən və səndən sonra islam dininin qələbəsindən ötrü hasil olan fəthlərdə və düşmənə qalib olub, islam dininin bütün yer kürəsinə az bir zamanda yayılmasında və müsəlmanların müşriklərə hakim olub, onları zəlil və məğlub etməsində bizim tövhid və qüdrətimizə və islam dininin haqq din olmasına işarə edən dəlil və**

اَوَلَمْ يَكْفِ بِرَبِّكَ اَنَّهُ عَلٰى كُلِّ شَيْءٍ شَهٖيدٌ﴿٥٣﴾ اَلَٓا اِنَّهُمْ فٖي مِرْيَةٍ مِنْ لِقَٓاءِ رَبِّهِمْ اَلَٓا اِنَّهُ بِكُلِّ شَيْءٍ مُحٖيطٌ﴿٥٤﴾

---

**sübutlarımızı cəmi insanlara göstəririk, ta ki, onlara aydın və aşkar olsun ki, Allah-Təala haqdır və ondan başqası batildir, bəlkə şirkdən qayıdıb tövhid və islam dininə inanalar. (اَوَلَمْ يَكْفِ بِرَبِّكَ اَنَّهُ عَلٰى كُلِّ شَيْءٍ شَهٖيدٌ) -** (Ey Məhəmməd), **bəs Quranın haqq olmağına bu kifayət etməz ki, sının rəbbin Allah-Təala hər bir şeyə şahid və görəndir, Quranı sənə göndərib, haqq olmasına şəhadət edir.**

*(*Qeyd: "Allah-Təala bu ayədə Allah Rəsulunun zamanında və o cənabdan sonra islam ümmətinin qələbələrini xəbər verib və o qələbələri islam dininin haqq olmasına böyük dəlil sayır. Həqiqətən də, belədir. İslam tarixinə agah olub, müsəlmanların savaş xüsusiyyətlərinə və hər bir millətlə cihad edəndə onların sayca azlığına və düşmənlərinin çoxluğuna və qələbələrinin xüsusiyyətinə və yer kürəsinə az bir zamanda yayılıb, böyük sultanları pərişan və zəlil edib, onlara qalib olmasına agah olub, diqqət edənlər əlbəttə, bunu islam dininin haqq olmasına böyük möcüzə və dəlil sayacaqlar. Ancaq inad və təəssüb səbəbi ilə inkar edənlər istisnadır).*

**54) (اَلَٓا اِنَّهُمْ فٖي مِرْيَةٍ مِنْ لِقَٓاءِ رَبِّهِمْ) - (Ey Məhəmməd), xəbərdar ol ki, müşriklər öz rəbləri Allah-Təalanın rəhmət və əzabı ilə qarşılaşmaq haqqında şəkk və şübhə içindədirlər, bu səbəbdən qiyamət gününə etiqad edən deyildirlər. (اَلَٓا اِنَّهُ بِكُلِّ شَيْءٍ مُحٖيطٌ) - Və xəbərdar ol,** (ey Məhəmməd), **həqiqətən, Allah-Təala hər bir şeyi ehtiva edib, agahdır. Heç bir şey ona məxfi qalmaz. Qiyamətə kafir olub şəkk içində olanlara öz əməllərinin, küfrlərinin cəzasını verəcəkdir.**

**Allaha həmd olsun! Səcdə surəsinin təfsiri tamamlandı. O, islam dininin haqq olmasına işarə edən dəlil və sübutları ehtiva edən bir surədir. Xüsusən bu axırıncı ayədən əvvəl bəhs olunan ayə həm islamın haqq olmasına, həm də tarix elminin şərəfinə böyük dəlildir. Diqqət etmək lazımdır, Allahın Rəsulu** (ə.s) **buyurubdur: "Kim, Səcdə surəsini oxusa, hər bir hərfinə Allah-Təala on savab bəxş edər."**

## əş-ŞURA SURƏSİ

42-cu surədir. Məkkədə nazil olub, 53 ayə, 860 kəlmə və 3577 hərfdir.

حٰمٓ ﴿١﴾ عٓسٓقٓ ﴿٢﴾ كَذٰلِكَ يُوحٖٓي اِلَيْكَ وَاِلَى الَّذٖينَ مِنْ قَبْلِكَۙ اللّٰهُ الْعَزٖيزُ الْحَكٖيمُ ﴿٣﴾ لَهُ
مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِؕ وَهُوَ الْعَلِيُّ الْعَظٖيمُ ﴿٤﴾ تَكَادُ السَّمٰوَاتُ يَتَفَطَّرْنَ مِنْ فَوْقِهِنَّ
وَالْمَلٰٓئِكَةُ يُسَبِّحُونَ بِحَمْدِ رَبِّهِمْ وَيَسْتَغْفِرُونَ لِمَنْ فِي الْاَرْضِؕ اَلَٓا اِنَّ اللّٰهَ هُوَ الْغَفُورُ الرَّحٖيمُ ﴿٥﴾
وَالَّذٖينَ اتَّخَذُوا مِنْ دُونِهٖٓ اَوْلِيَٓاءَ اللّٰهُ حَفٖيظٌ عَلَيْهِمْۘ

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1-2) (حٰمٓ عٓسٓقٓ) - Bu mübarək surənin adıdır.**

**3) (كَذٰلِكَ يُوحٖٓي اِلَيْكَ وَاِلَى الَّذٖينَ مِنْ قَبْلِكَۙ اللّٰهُ الْعَزٖيزُ الْحَكٖيمُ) -** (Ey Məhəmməd), **Allah-Təala bu Qurani-Şərifdə sənə vəhy edən kimi səndən əvvəlki peyğəmbərlərə də vəhy göndəribdir ki, xalqa çatdırsınlar. Vahid, yeganə Allah-Təala öz müqəddəs varlığı ilə məxluqata qalibdir və hər bir feil və əməl ondan hikmət üzrə meydana gəlir.**

**4) (لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِؕ وَهُوَ الْعَلِيُّ الْعَظٖيمُ) - Göylərdə və yerdə olan şeylərin hakimiyyəti Allah-Təalaya məxsusdur. O, mərtəbəsi böyük və şanı uca olan Allah-Təaladır, ondan uca heç bir şey yoxdur.**

**5) (تَكَادُ السَّمٰوَاتُ يَتَفَطَّرْنَ مِنْ فَوْقِهِنَّ) -** (Ey Məhəmməd), **hər bir şeyə üstün və sahib olan Allah-Təalanın qorxusundan, dəhşətindən az qalır ki, göylər üst tərəflərindən parçalanıb dağılsınlar. Amma insan nəsli bunu düşünüb, Allah-Təalanın əzəmətini dərk etmir.**

**(وَالْمَلٰٓئِكَةُ يُسَبِّحُونَ بِحَمْدِ رَبِّهِمْ وَيَسْتَغْفِرُونَ لِمَنْ فِي الْاَرْضِؕ) - Məlaikə** (mömin insanlarda zühur edən müqəddəs ruhanilik) **rəbləri Allah-Təalaya həmd-səna etməklə, hər bir eyib və nöqsandan onu pak və müqəddəs sayıb, yer üzündəki möminlərdən ötrü əfv istəyərlər.** (Möminlərdə müqəddəs ruhaniliyin zühur etməsi deməkonlardan ötrü Allah-Təala yanında əfv və ilahi lütfə nail olmaqdır). **(اَلَٓا اِنَّ اللّٰهَ هُوَ الْغَفُورُ الرَّحٖيمُ) -** (Ey Məhəmməd), **agah ol ki, həqiqətən, Allah-Təala məlaikənin əfv istəməsi səbəbi ilə möminlərə rəhm edib xətalarını bağışlayandır.**

**6) (وَالَّذٖينَ اتَّخَذُوا مِنْ دُونِهٖٓ اَوْلِيَٓاءَ) -** (Ey Məhəmməd), **o şəxslər ki, Allah-Təaladan başqa özlərinə dostlar seçib, onlara ibadət edib, Allah-Təalaya şərik qoşurlar, (اللّٰهُ حَفٖيظٌ عَلَيْهِمْ) - Allah-Təala onların əhvallarına, hər bir hərəkət**

وَمَٓا اَنْتَ عَلَيْهِمْ بِوَكٖيلٍ ﴿٦﴾ وَكَذٰلِكَ اَوْحَيْنَٓا اِلَيْكَ قُرْاٰنًا عَرَبِيًّا لِتُنْذِرَ اُمَّ الْقُرٰى وَمَنْ حَوْلَهَا وَتُنْذِرَ يَوْمَ الْجَمْعِ لَا رَيْبَ فٖيهِۜ فَرٖيقٌ فِي الْجَنَّةِ وَفَرٖيقٌ فِي السَّعٖيرِ ﴿٧﴾ وَلَوْ شَٓاءَ اللّٰهُ لَجَعَلَهُمْ اُمَّةً وَاحِدَةً وَلٰكِنْ يُدْخِلُ مَنْ يَشَٓاءُ فٖي رَحْمَتِهٖۜ وَالظَّالِمُونَ مَا لَهُمْ مِنْ وَلِيٍّ وَلَا نَصٖيرٍ ﴿٨﴾ اَمِ اتَّخَذُوا مِنْ دُونِهٖٓ اَوْلِيَٓاءَۚ فَاللّٰهُ هُوَ الْوَلِيُّ وَهُوَ يُحْيِ الْمَوْتٰىۘ وَهُوَ عَلٰى كُلِّ شَيْءٍ قَدٖيرٌ ۟

---

**və davranışlarına nəzarət edəndir. Əməllərini qeyd edib, heç bir şeyi gözdən qaçırmaz.** (وَمَٓا اَنْتَ عَلَيْهِمْ بِوَكٖيلٍ) **-** (Ey Məhəmməd), **daha sən onlara vəkil deyilsən, işləri sənə həvalə olunmayıb, ancaq sən onları imana dəvət edib, bizim əzabımızla qorxudansan. Digər işləri və haqq-hesabları bizə həvalədir. Onların əməllərinə görə onlarla rəftar edəcəyik.**

**7)** (وَكَذٰلِكَ اَوْحَيْنَٓا اِلَيْكَ قُرْاٰنًا عَرَبِيًّا) **-** (Ey Məhəmməd), **habelə xalqı dəvət etməkdən ötrü həmin Quranı ərəb dilində sənə göndərdik.**

(لِتُنْذِرَ اُمَّ الْقُرٰى وَمَنْ حَوْلَهَا وَتُنْذِرَ يَوْمَ الْجَمْعِ لَا رَيْبَ فٖيهِ) **Belə ki, Məkkə və onun ətrafında olan ərəbləri bizim əzabımızla qorxudasan, xüsusən qiyamət gününün dəhşəti ilə onları qorxudasan ki, o günün vaqe olmağında heç bir şəkk və şübhə yoxdur.**

**Bəlkə qorxub iman edərlər.** (فَرٖيقٌ فِي الْجَنَّةِ وَفَرٖيقٌ فِي السَّعٖيرِ) **-** (Ey Məhəmməd), **onlara dəvət məqamında bildirəsən ki, onlardan bir qrup** (Allah-Təalaya itaət edib müvəhhid olan qrup) **cənnətdə olacaqdır. Digər qrup** (müşriklər, Allah-Təalaya asi olanlar) **cəhənnəmdə olacaqdır. Ağıllı şəxs cənnət əvəzinə cəhənnəmi seçərmi?**

**8)** (وَلَوْ شَٓاءَ اللّٰهُ لَجَعَلَهُمْ اُمَّةً وَاحِدَةً) **-** (Ey Məhəmməd), **əgər Allah-Təala istəsəydi, bütün insanları zorla imana daxil edib, müvəhhid edərdi. Lakin Allah-Təalanın iradəsi hər bir şəxsin öz istəyi ilə imana daxil olub, olmaması yönündə olduğuna görə insanları zorla imana daxil etmədi.**

(وَلٰكِنْ يُدْخِلُ مَنْ يَشَٓاءُ فٖي رَحْمَتِهٖ) **- Lakin Allah-Təala hər bir şəxsi ki, istəsə** (öz iradəsi ilə imana daxil olan şəxsi) **öz rəhmətinə daxil edər.**

(وَالظَّالِمُونَ مَا لَهُمْ مِنْ وَلِيٍّ وَلَا نَصٖيرٍ) **- Amma zalım şəxslərdən** (öz arzuları ilə küfr və zəlalətdə qalanlardan) **ötrü qiyamət günündə nə bir dost, nə bir kömək olmaz ki, bizim əzabımızdan onları xilas etsin.**

**9)** (اَمِ اتَّخَذُوا مِنْ دُونِهٖٓ اَوْلِيَٓاءَۚ فَاللّٰهُ هُوَ الْوَلِيُّ وَهُوَ يُحْيِ الْمَوْتٰىۘ وَهُوَ عَلٰى كُلِّ شَيْءٍ قَدٖيرٌ) **-**(Ey Məhəmməd), **bəlkə, müşriklər Allah-Təaladan başqa dostlar seçib özlərinə məbud ediblər. Halbuki əgər haqq və doğru yolla özlərinə məbud seçmək istəsələr, sevilməyə və məbud olmağa ancaq yeganə Allah-Təala layiqdir. Hansı ki ölülərə həyat verib, hər bir şeyə qadirdir. Gərək belə Allah-Təalanı sevib, özlərinə məbud etsinlər. Ondan başqasını sevib, məbud saymaq insafsızlıqdır.**

﴿٩﴾ وَمَا اخْتَلَفْتُمْ فِيهِ مِنْ شَيْءٍ فَحُكْمُهُ اِلَى اللّٰهِ

---

**10) (وَمَا اخْتَلَفْتُمْ فِيهِ مِنْ شَيْءٍ فَحُكْمُهُ اِلَى اللّٰهِ) -** (Ey Məhəmməd), **insanlara de ki, hər bir zaman ki dini bir məsələdə ixtilaf etdiniz, onun hökmünü Allah-Təalaya* həvalə edin, (O şeyin hökmünü Allah-Təala sizdən ötrü ya Qurani-Şərifdə, ya da ki mənə lütf və mərhəmət edərək verdiyi ağılda yerləşdiribdir. O şeyin hökmünü gərək qəbul edəsiniz.**

*(* **Qeyd:** "Allah-Təala möhtərəm və uca peyğəmbərimiz Məhəmməd ibn Abdullahı (ə.s) Qurani-Şəriflə birlikdə bizə göndərib, həmin peyğəmbərin vasitəsi ilə həm Qurani-Şərifdə sabit olan və həm özünün möcüzəli bəyanları ilə verilən ehkama əməl etməyə bizi məsul edibdir və bu səbəbdən biz islam ümməti əvvəlcə Qurani-Şərifdə verilən ehkama əməl etməyə məcburuq, necə ki, bəyan olunubdur. Azaldıb-çoxaltmadan olduğu kimi gərək əməl edib, ona zidd getməyək, ondan sonra hansı bir hökm ki, onun bəyanı Qurani-Şərifdə varid olmayıbdır, ondan ötrü gərək peyğəmbərin hədislərinə baxıb, o cənabın möcüzəli kəlamları ilə bəyan olunan hökmə tabe olub, ona əməl etməyi özümüzə fərz sayaq. Bəs biz islam ümmətinin əməli belədirmi? Əgər belə olsaydı, fəlakət və rəzalət gününə düşüb, neçə qrupa bölünüb, bir-birimizi təkfir edib küfr və zındıqlıq isnad etməzdik. Bu ayrılıq və ixtilafın səbəbi hərçənd məlum isə də, lakin oxuculardan ötrü müxtəsər şəkildə bəyan etmək faydasız deyildir. Adlarını müsəlmanları və islam ehkamını müdafiə və himayə edən qoyub, əslində islamı pozan və ona zidd olanlar, öz nəfslərinə tabe olub, hakimiyyət səbəbi ilə Qurani-Şərifin xilafına uydurma hədislər vəz edib, uca səhabələrin dili ilə Allahın Rəsuluna isnad edib, xalqın arasında yayıblar. Xalq avam olduğu üçün bu uydurma hədislərin Qurani-Şərifə müxalif olmasından qafil olublar. Bu sözləri Allah Rəsulunun adı ilə ürəkdən qəbul edib, itaət və əməl etməyi özlərinə fərz sayıblar və bu uydurma hədislər xalq arasında rəvac tapdıqca yavaş-yavaş islam ümməti arasında ayrılıq peyda olub, neçə qrupa bölünüblər. Hər qrup özlərinin əməl etdiyi ehkamı, hansı ki, o yalan və Qurana zidd olan hədislərdən çıxarılıbdır, haqq və doğru sayıb, digər qrupun ehkam və məzhəbinin batil olmasına hökm edib, özlərini qurtulmuş qrup adlandırıblar. Lakin bundan qafil olublar ki, qurtulmuş qrup o qrupdur ki, Qurani-Şərifə eynilə əməl edib, Qurana zidd olan hədislərdən çəkinir. Bir ümmət ki, rəy sahiblərinin rəyini Qurandan üstün saysın, görəsən, o ümmətdən ötrü nicat olarmı? Onlara deyəndə ki, filan hökm Qurani-Şərifdə belədir, gərək Qurana tabe olaq, cavabında deyərlər: "Biz filan müftü və filan müctəhiditəqlid edirik, onun fətvasına gərək tabe olaq. Bəs bu Qurani-Kərimin hikmətli hökmü harada qaldı? İslam ümmətini əcəb qəflət yuxusu tutub, Qurana zidd olan şeyləri özlərinə ehkam seçib, Qurani-Şərifin hökmünü hökmsüz və məxfi saxlayıblar. Əgər bizim aramızda əməl edilən Qurana zidd hökmləri bəyan etsəm, uzunçuluq olar. Bir neçəsini bu kitabın I cildinin əvvəlində bəyan etmişəm. Oraya baxılsın. Allah hidayətə və savab yola götürəndir).*

ذٰلِكُمُ اللّٰهُ رَبّ۪ي عَلَيْهِ تَوَكَّلْتُۗ وَاِلَيْهِ اُن۪يبُ ﴿١٠﴾ فَاطِرُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ جَعَلَ لَكُمْ مِنْ اَنْفُسِكُمْ اَزْوَاجًا
وَمِنَ الْاَنْعَامِ اَزْوَاجًاۚ يَذْرَؤُ۬كُمْ ف۪يهِۜ لَيْسَ كَمِثْلِه۪ شَيْءٌۚ وَهُوَ السَّم۪يعُ الْبَص۪يرُ ﴿١١﴾ لَهُ مَقَال۪يدُ السَّمٰوَاتِ
وَالْاَرْضِۚ يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ وَيَقْدِرُۜ اِنَّهُ بِكُلِّ شَيْءٍ عَل۪يمٌ ﴿١٢﴾ شَرَعَ لَكُمْ مِنَ الدّ۪ينِ مَا وَصّٰى بِه۪
نُوحًا وَالَّذ۪ٓي اَوْحَيْنَٓا اِلَيْكَ وَمَا وَصَّيْنَا بِه۪ٓ اِبْرٰه۪يمَ وَمُوسٰى وَع۪يسٰٓى اَنْ اَق۪يمُوا الدّ۪ينَ وَلَا تَتَفَرَّقُوا ف۪يهِۜ

---

(ذٰلِكُمُ اللّٰهُ رَبّ۪ي عَلَيْهِ تَوَكَّلْتُۗ وَاِلَيْهِ اُن۪يبُ) - **Hər bir şeyin hökmünü** (iki məqamda - ya Qurani-Şərifdə, ya da mənə bəxş etdiyi ağıl vasitəsi ilə) **sizdən ötrü bəyan edən mənim rəbbim Allah-Təaladır. Hər bir işimdə ona təvəkkül edib, ona yönəlirəm ki, dini məsələlərdə hər bir çətin işim həll olsun.**

**11)** (فَاطِرُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ جَعَلَ لَكُمْ مِنْ اَنْفُسِكُمْ اَزْوَاجًا) - **Göyləri və yeri yoxdan yaradan Allah-Təala siz insanların kişi cinsindən ötrü öz nəfsinizdən qadınları yaratdı. ki, onlara isinişib, aranızda evlilik meydana gəlsin.** (وَمِنَ الْاَنْعَامِ اَزْوَاجًا) - **Dörd ayaqlı heyvanların da öz cinslərindən özlərindən ötrü dişilər yaratdı. Necə ki, sizdən ötrü də yaratmışdı.** (يَذْرَؤُ۬كُمْ ف۪يهِ) - **Bu tədbirlə-sizin cinsinizdən sizdən ötrü xanımlar seçməklə sizi artırıb yer üzündə yayır.** (لَيْسَ كَمِثْلِه۪ شَيْءٌۚ وَهُوَ السَّم۪يعُ الْبَص۪يرُ) - **Allah-Təalanın müqəddəs zatına oxşar olan heç bir şey yoxdur. Cəmi şeylər onun məxluqudur. Məxluq xaliq** (yaradıcı) **kimi ola bilməz. Hər bir sözü eşidib və hər bir şeyi görüb agah olan Allah-Təaladır.**

**12)** (لَهُ مَقَال۪يدُ السَّمٰوَاتِ وَالْاَرْضِۚ) - **Göylərin və yerin xəzinələrinin açarı Allah-Təalaya məxsusdur. Göydən su göndərib, sizdən ötrü hər bir qisim ruziləri yerdən çıxarır.** (يَبْسُطُ الرِّزْقَ لِمَنْ يَشَٓاءُ وَيَقْدِرُ) - **Allah-Təala istəsə, hər bir şəxsə ruzisini bol verib, firavan edər və hər bir şəxsə istəsə ruzisini qıt edər. Hikməti üzrə insanların bəzisini varlı, bəzisini yoxsul edər.**

(اِنَّهُ بِكُلِّ شَيْءٍ عَل۪يمٌ) - **Həqiqətən, Allah-Təala hər bir şeydən agahdır. Hər bir şəxsin halını mülahizə edib, ona ruzi verər.**

**13)** (شَرَعَ لَكُمْ مِنَ الدّ۪ينِ مَا وَصّٰى بِه۪ نُوحًا وَالَّذ۪ٓي اَوْحَيْنَٓا اِلَيْكَ وَمَا وَصَّيْنَا بِه۪ٓ اِبْرٰه۪يمَ وَمُوسٰى وَع۪يسٰٓى) - (Ey Məhəmməd), **həmin dini ki, Allah-Təala səndən əvvəl şəriət sahibi olan peyğəmbərlərin birincisi olan Nuha, ondan sonra İbrahimə, Musa və İsaya vəsiyyət edib əmr edibdir, gərək, o dinə əməl edib ümmətlərinə yetirsinlər. Həmin dindir ki, sənə vəhy edib, sənin ümmətindən ötrü o dini - islam dinini, müvəhhid olub şirki tərk etməyi təyin etdik. İslam dini bəhs olunan şəriət sahibi olan peyğəmbərlərin dinidir. O dinin səhhətində bu rəislər ittifaq ediblər.** (اَنْ اَق۪يمُوا الدّ۪ينَ وَلَا تَتَفَرَّقُوا ف۪يهِ) - **Allah-Təala islam dinini sizdən ötrü təyin edib, sizə əmr edir ki, siz Məhəmməd (ə.s) ümməti həmin dini bərqərar edib –** (müvəhhid olub, Allah-Təalaya və onun kitablarına və peyğəmbərlərinə iman edib), **o dində pərən-pərən olmayıb,**

كَبُرَ عَلَى الْمُشْرِكِينَ مَا تَدْعُوهُمْ اِلَيْهِ ؕ اَللّٰهُ يَجْتَبِيٓ اِلَيْهِ مَنْ يَشَآءُ وَيَهْدِيٓ اِلَيْهِ مَنْ يُنِيبُ ﴿١٣﴾

---

**ixtilaf etməyin. (**كَبُرَ عَلَى الْمُشْرِكِينَ مَا تَدْعُوهُمْ اِلَيْهِ**) - Siz müsəlmanların tövhid tərəfinə dəvət etməsi müşriklərə ağır* gəlir ki, necə o çox məbudları tərk edib yeganə Allah-Təalaya sitayiş etsinlər?**

*(****Qeyd:*** *"Müşriklər ata-babalarından təqlid etdikləri din və məzhəbə alışıb, hüsn-rəğbət etdikləri üçün onları tövhidə dəvət etmək istəmək, alışdıqları dinin xilafınadır, onlara ağır gəlirdi. Cəhalət onlara qalib gəlib, pisə-yaxşıya fərq qoymadıqları üçün həmin din və ayinlərini haqq bilib, haqqa dəvət edənlərə qulaq asmırdılar. Həqiqətən, cəhalət və təqlid böyük fəlakətlərə səbəb olan xəstəlikdir. Əlacı ancaq səbir etməkdir. Necə ki, bizim bu zamanda elm günəşi səmada parlayarkən, islam ümməti islam dininin əsas qanunu olan Qurani-Şərifdən qafil olub, cəhalət onları elə bürüyübdür ki, nə vaxt onlara Qurani-Şərifin hökmünü - hansı ki, onların arasında əməl edilən saxta hökmlərə ziddir - bildirəndə, müşriklərin peyğəmbərin zamanında dedikləri sözləri - ata-babamızı bu dində görüb, onlara tabe olmuşuq, bunlar da deyib Qurani-Şərifin hökmünü kənara elə qoyarlar ki, onların söz və əməllərindən Qurani-Şərifi öpüb, gözlərinin üstünə qoymaqdan və ölü üstündə oxumaqdan başqa bir şeyə lazım olmadığı məlum olur. İslam ümmətini bu cəhalətə və axmaqlığa vadar edən onların əksər ruhani rəisləridir. Bir ayə - hansı ki, onların nəfsani şər arzularına müxalif olub, onlara varid olanda, onu ötrü öz xəyalları ilə tərtib etdikləri qayda və üsullar ilə məhdud şərtlərə bağlayıb, ayənin gəlmə səbəbi olan həqiqi mənasını hökmsüz edib, ona başqa məntiqsiz mənalar yükləyərlər. Qurani-Şərifdə bəhs olunan miras ehkamına və halal-harama baxanda, bizim aramızda Allah ehkamı adlanan ehkamın onlara zidd olduğunu görərsən. Bəs Qurani-Kərimin açıq-aydın ayələrini ravi (rivayətçi) sənədi naməlum olan hədislə, "xəbəri-vahid"lə (bir nəfərdən rəvayət edilən hədislə) məhdud şərtlərə bağlamaq və ya birdəfəlik hökmsüz etmək rəvadırmı? Görəsən, islam dininin əsası belə qoyulub? Nəticə olaraq, Qurani-Şərifin tabe olunması vacib olan ehkamı islam ümməti tərəfindən tərk edildiyi üçün, onları cəhalət və zəlalət tutub, pərən-pərən olub, bir-birilərini təkfir edirlər. Bir kitaba inanan ümmətin özlərinə müsəlman adından başqa adlar qoyub, o adlarla fəxr edib, hər qrupun özünü qurtulmuş, digərlərini zəlil və rəzil adlandırması onların cəhalət və zəlalətinə şahid deyilmi? Gərək islam ümməti Qurani-Şərifin ehkamında birləşib, nəfsani arzularla yaratdıqları bidətləri dəf etməkdə səy və cəhd etsinlər. Qurani-Şərifin xilafına dəvət edən din düşmənlərindən uzaq olmaq lazımdır. Müvəffəq edən Allahdır).*

**(**اَللّٰهُ يَجْتَبِيٓ اِلَيْهِ مَنْ يَشَآءُ وَيَهْدِيٓ اِلَيْهِ مَنْ يُنِيبُ**) - Allah-Təala hər bir şəxsi** (tövbə edənləri) **istəsə, imandan ötrü seçib, öz tərəfinə cəlb edər və bir şəxs ki,**

وَمَا تَفَرَّقُوٓا اِلَّا مِنْ بَعْدِ مَا جَٓاءَهُمُ الْعِلْمُ بَغْيًا بَيْنَهُمْۜ وَلَوْلَا كَلِمَةٌ سَبَقَتْ مِنْ رَبِّكَ اِلٰٓى اَجَلٍ مُسَمًّى لَقُضِيَ بَيْنَهُمْۜ وَاِنَّ الَّذٖينَ اُورِثُوا الْكِتَابَ مِنْ بَعْدِهِمْ لَفٖي شَكٍّ مِنْهُ مُرٖيبٍ ﴿١٤﴾ فَلِذٰلِكَ فَادْعُۚ وَاسْتَقِمْ كَمَٓا اُمِرْتَۚ وَلَا تَتَّبِعْ اَهْوَٓاءَهُمْۚ وَقُلْ اٰمَنْتُ بِمَٓا اَنْزَلَ اللّٰهُ مِنْ كِتَابٍۚ وَاُمِرْتُ لِاَعْدِلَ بَيْنَكُمْۜ اَللّٰهُ رَبُّنَا وَرَبُّكُمْۜ لَنَٓا اَعْمَالُنَا وَلَكُمْ اَعْمَالُكُمْ

---

**hər bir işində Allah-Təalaya yönələ, elə şəxsi də Allah-Təala iman tərəfinə hidayət edər.**

**14) (وَمَا تَفَرَّقُوٓا اِلَّا مِنْ بَعْدِ مَا جَٓاءَهُمُ الْعِلْمُ) -** (Ey Məhəmməd), **kitab əhli** (xristian və yəhudilər) **peyğəmbərlərindən sonra din və məzhəblərində zəlalətdə olduqları üçün deyil, ancaq onlara elm verilib alim olandan sonra ixtilaf edib pərən-pərən oldular. (بَغْيًا بَيْنَهُمْ) Bu ixtilaf etmələri onların bir-birilərinə həsəd edib, aralarındakı zülmün yayılması səbəbi ilə meydana gəldi.**

**Bu hökm ruhani rəislərinə məxsusdur. Agah olsunlar.**

**(وَلَوْلَا كَلِمَةٌ سَبَقَتْ مِنْ رَبِّكَ اِلٰٓى اَجَلٍ مُسَمًّى لَقُضِيَ بَيْنَهُمْ)** - (Ey Məhəmməd), **əgər sənin rəbbin Allah-Təaladan bu hökm olmasaydı ki, gərək onların əzabı qiyamət gününə qədər təxirə salınsın, hər halda onların arasında fəlakətə hökm edilib, hamısı həlak olub, bir nəfər də onlardan sağ qalmazdı. (وَاِنَّ الَّذٖينَ اُورِثُوا الْكِتَابَ مِنْ بَعْدِهِمْ لَفٖي شَكٍّ مِنْهُ مُرٖيبٍ)** - (Ey Məhəmməd), **kitab əhlinin gənclərinin xüsusiyyəti belədir ki, bəhs olundu və həqiqətən, onlardan sonra sənin bu zamanında olub kitaba** (Tövrat və İncilə) **varis olanlar da o kitabın haqqında özləri şəkdə olmaqdan başqa özgələrini də şəkkə salırlar.** (Kaş ki, siz islam alimləri də onlar kimi olmayıb, xalqı şəkk və zəlalətə vaqe etməyəsiniz). **İlahi, islam ümməti arasında yayılan məzhəb ixtilafı dil açıb, yalvarıb deyir: "Ey rəbb, gəl, islam ümmətini bu halətə salan kimlərdir? Bu zəlalət, bu cəhalət, bu məzhəb ixtilafı kimlərin vasitəsilə ilə zühur etdi? İlahi, əlbəttə, deyəcəksən: rəy sahiblərindən meydana gəlib, zühur etdi).**

**15) (فَلِذٰلِكَ فَادْعُۚ وَاسْتَقِمْ كَمَٓا اُمِرْتَ)** - (Ey Məhəmməd), **bu küfr və ixtilaf və bu şirk, nifaqdan xalqı tövhid və ittifaqa dəvət edib, necə ki, Allah-Təala sənə əmr edir, bunda möhkəm və bərqərar ol. (وَلَا تَتَّبِعْ اَهْوَٓاءَهُمْ) - Xalqın müxtəlif və batil istəklərinə tabe olma. (وَقُلْ اٰمَنْتُ بِمَٓا اَنْزَلَ اللّٰهُ مِنْ كِتَابٍۚ وَاُمِرْتُ لِاَعْدِلَ بَيْنَكُمْ) - De ki,** (ey Məhəmməd), **hər bir kitabı ki, Allah-Təala göndərib, mən onları təsdiq edib iman etmişəm, o zaman ki, hər işinizdə mübahisə edib, mənim hökmümə döndünüz, Allah-Təala tərəfindən əmr olunmuşam ki, sizin aranızda haqq və ədalətlə hökm edim.**

**(اَللّٰهُ رَبُّنَا وَرَبُّكُمْۜ لَنَٓا اَعْمَالُنَا وَلَكُمْ اَعْمَالُكُمْ)** - (Ey Məhəmməd), **de ki, ey müşriklər, bizim və sizin rəbbiniz yeganə Allah-Təaladır. Bizim əməlimiz bizdən ötrü, sizin əməliniz sizdən ötrü olsun. Hər bir şəxs öz əməlinin cəzasına**

ۖ لَا حُجَّةَ بَيْنَنَا وَبَيْنَكُمْ ۖ اَللّٰهُ يَجْمَعُ بَيْنَنَا ۚ وَاِلَيْهِ الْمَصِيرُ ۖ﴿١٥﴾ وَالَّذِينَ يُحَآجُّونَ فِي اللّٰهِ مِنْ بَعْدِ مَا
اسْتُجِيبَ لَهُ حُجَّتُهُمْ دَاحِضَةٌ عِنْدَ رَبِّهِمْ وَعَلَيْهِمْ غَضَبٌ وَلَهُمْ عَذَابٌ شَدِيدٌ ﴿١٦﴾ اَللّٰهُ الَّذِيٓ اَنْزَلَ
الْكِتَابَ بِالْحَقِّ وَالْمِيزَانَ ۗ وَمَا يُدْرِيكَ لَعَلَّ السَّاعَةَ قَرِيبٌ ﴿١٧﴾ يَسْتَعْجِلُ بِهَا الَّذِينَ لَا يُؤْمِنُونَ بِهَا ۚ
وَالَّذِينَ اٰمَنُوا مُشْفِقُونَ مِنْهَا ۙ وَيَعْلَمُونَ اَنَّهَا الْحَقُّ ۗ اَلَآ اِنَّ الَّذِينَ يُمَارُونَ فِي السَّاعَةِ لَفِي ضَلَالٍ بَعِيدٍ
﴿١٨﴾ اَللّٰهُ لَطِيفٌ بِعِبَادِهِ يَرْزُقُ مَنْ يَشَآءُ ۚ وَهُوَ الْقَوِيُّ الْعَزِيزُ ۚ﴿١٩﴾

---

**yetişəcəkdir.** (لَا حُجَّةَ بَيْنَنَا وَبَيْنَكُمْ ۖ اَللّٰهُ يَجْمَعُ بَيْنَنَا ۚ وَاِلَيْهِ الْمَصِيرُ) **- Bizimlə sizin aranızda daha heç bir mübahisə yoxdur. Çünki haqq zahir olub, sizin batil olmağınız aşkar olub, sizdən ötrü heç bir dəlil qalmayıbdır ki, haqq din olan islamınn müqabilində gətirəsiniz. Bizim və sizin qayıdacağınız yer Allah-Təalanın tərəfinədir. Qiyamət günündə bizim hamımızı bir məqama cəm edib, sizdən intiqam alacaqdır.**

**16)** (وَالَّذِينَ يُحَآجُّونَ فِي اللّٰهِ مِنْ بَعْدِ مَا اسْتُجِيبَ لَهُ) - (Ey Məhəmməd), **islam dini zahir olub, xalq islama daxil olandan sonra o şəxslər ki, tövhid və islam dini haqqında və onu batil etmək üçün mübahisə və qovğa edirlər,** (حُجَّتُهُمْ دَاحِضَةٌ عِنْدَ رَبِّهِمْ وَعَلَيْهِمْ غَضَبٌ وَلَهُمْ عَذَابٌ شَدِيدٌ) **onların dəlilləri rəbləri Allah-Təalanın yanında batildir. Onlarda heç bir təsir olmayacaqdır. Allah-Təalanın qəzəbi onları tutub, onlardan ötrü qiyamət günündə şiddətli əzab hazırlanmışdır.**

**17)** (اَللّٰهُ الَّذِيٓ اَنْزَلَ الْكِتَابَ بِالْحَقِّ وَالْمِيزَانَ) **-** (Ey Məhəmməd), **Allah-Təala insan nəslindən ötrü batildən uzaq olan haqq və ədaləti ehtiva edən, hər bir hökmün ölçüsü olan kitabı** (Quran) **nazil etdi. Ta ki, xalq din və dünya işlərində ondan faydalanıb, xeyir əməl etməyi özlərinə şüar etsinlər.** (وَمَا يُدْرِيكَ لَعَلَّ السَّاعَةَ قَرِيبٌ) - (Ey Məhəmməd), **qiyamətin nə vaxt olacağını sənə bildirməyibdir. Bəlkə də, qiyamət yaxındır, sən ondan agah deyilsən.**

**18)** (يَسْتَعْجِلُ بِهَا الَّذِينَ لَا يُؤْمِنُونَ بِهَا ۚ) **-** (Ey Məhəmməd), **qiyamətə iman etməyənlər, onun tez gəlməsini istəyib deyirlər: "Qiyamət nədən ötrü tez vaqe olmur, bəs nə vaxt vaqe olacaqdır?"** (وَالَّذِينَ اٰمَنُوا مُشْفِقُونَ مِنْهَا ۙ وَيَعْلَمُونَ اَنَّهَا الْحَقُّ) **- Amma iman edənlər, qiyamətin haqq olmağını bilib, qiyamətdən qorxarlar ki, birdən onlara əzab olunar.** (اَلَآ اِنَّ الَّذِينَ يُمَارُونَ فِي السَّاعَةِ لَفِي ضَلَالٍ بَعِيدٍ) **-** (Ey Məhəmməd), **xəbərdar ol ki, həqiqətən, o şəxslər ki, qiyamət haqqında möminlərlə mübahisə və qovğa edirlər, əlbəttə, onlar haqdan son dərəcə uzaq və zəlalətdədirlər.**

**19)** (اَللّٰهُ لَطِيفٌ بِعِبَادِهِ يَرْزُقُ مَنْ يَشَآءُ ۚ وَهُوَ الْقَوِيُّ الْعَزِيزُ) **- Allah-Təala bəndələrinə lütf və mərhəmət sahibi olub, çox yaxşılıq edəndir. Hər bir şəxsə istədiyi qədər ruzi verər. Allah-Təala sonsuz qüdrət sahibi və hər bir şeyə qalibdir.**

مَنْ كَانَ يُرِيدُ حَرْثَ الْاٰخِرَةِ نَزِدْ لَهُ فِي حَرْثِهٖۚ وَمَنْ كَانَ يُرِيدُ حَرْثَ الدُّنْيَا نُؤْتِهٖ مِنْهَا وَمَا لَهُ فِي الْاٰخِرَةِ مِنْ نَصِيبٍ ﴿٢٠﴾ اَمْ لَهُمْ شُرَكٰٓؤُا شَرَعُوا لَهُمْ مِنَ الدِّينِ مَا لَمْ يَأْذَنْ بِهِ اللّٰهُۜ وَلَوْلَا كَلِمَةُ الْفَصْلِ لَقُضِيَ بَيْنَهُمْۜ وَاِنَّ الظَّالِمِينَ لَهُمْ عَذَابٌ اَلِيمٌ ﴿٢١﴾ تَرَى الظَّالِمِينَ مُشْفِقِينَ مِمَّا كَسَبُوا وَهُوَ وَاقِعٌ بِهِمْۜ وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ فِي رَوْضَاتِ الْجَنَّاتِۚ لَهُمْ مَا يَشَٓاؤُ۫نَ عِنْدَ رَبِّهِمْۜ ذٰلِكَ هُوَ الْفَضْلُ الْكَبِيرُ ﴿٢٢﴾ ذٰلِكَ الَّذِي يُبَشِّرُ اللّٰهُ عِبَادَهُ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِۜ قُلْ لَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ اَجْرًا اِلَّا الْمَوَدَّةَ فِي الْقُرْبٰىۜ

---

**20) (مَنْ كَانَ يُرِيدُ حَرْثَ الْاٰخِرَةِ نَزِدْ لَهُ فِي حَرْثِهٖۚ) -** (Ey Məhəmməd), **kim ki, axirət qazancını istəyib, əməli axirətdən ötrü olmuş olsa, ondan ötrü qazancını (əcr-savabını) çox edərik, (وَمَنْ كَانَ يُرِيدُ حَرْثَ الدُّنْيَا نُؤْتِهٖ مِنْهَا وَمَا لَهُ فِي الْاٰخِرَةِ مِنْ نَصِيبٍ)- və kim ki, dünya qazancını istəyib, əməli dünyadan ötrü olmuş olsa, əvvəlcə dünyadan ona bir şeylər verərik, amma daha ondan ötrü axirətdə heç bir nəsib və pay olmayıb, axirət savabından məhrum olacaqdır.**

**21) (اَمْ لَهُمْ شُرَكٰٓؤُا شَرَعُوا لَهُمْ مِنَ الدِّينِ مَا لَمْ يَأْذَنْ بِهِ اللّٰهُ) - Ya da ki bəlkə müşriklərin Allah-Təalanın izin vermədiyi dini ehkamları gətirən bəzi şərikləri** (bütlər) **vardır? O səbəbdən o ehkamlara tabe olub, Allah-Təalanın hökmlərinə itaət etmirlər? Halbuki bütlər belə hökmlər verməyə qadir deyildirlər, müşriklər özlərindən hökmlər düzəldirlər.**

**( وَلَوْلَا كَلِمَةُ الْفَصْلِ لَقُضِيَ بَيْنَهُمْۜ وَاِنَّ الظَّالِمِينَ لَهُمْ عَذَابٌ اَلِيمٌ) - Əgər Allah-Təalanın sabiq hökmü olmasaydı ki, asilərin əzabı gərək qiyamətə qədər təxirə salınsın, hər halda onların fəlakəti üçün hökm olunub, hamısı həlak olub, bir nəfər də asi və müşrik qalmazdı. Lakin onların əzabı qiyamətə qalıbdır. Həqiqətən, qiyamət günündə zalımlardan ötrü əziyyət verən əzab hazırdır.**

**22) (تَرَى الظَّالِمِينَ مُشْفِقِينَ مِمَّا كَسَبُوا وَهُوَ وَاقِعٌ بِهِمْ) -** (Ey Məhəmməd), **qiyamət günündə zalımları dünyada qazandıqları əməllərin cəzasından şiddətli qorxan halda, görərsən, halbuki qorxdular, qorxmadılar, əməllərinin əzabı onlara yetişəcəkdir. (وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ فِي رَوْضَاتِ الْجَنَّاتِ) - Amma o şəxslər ki iman edib, xeyir əməl edir, onlar cənnət bağçalarında olarlar. (لَهُمْ مَا يَشَٓاؤُ۫نَ عِنْدَ رَبِّهِمْۜ ذٰلِكَ هُوَ الْفَضْلُ الْكَبِيرُ) - O möminlərdən ötrü öz rəbləri Allah-Təalanın yanında istədikləri hər şey hazırdır, bu savablar bəndələrin az əməllərinə Allah-Təaladan böyük lütfdür.**

**23) (ذٰلِكَ الَّذِي يُبَشِّرُ اللّٰهُ عِبَادَهُ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِۜ) - Bu böyük savab Allah-Təaladan o savabdır ki, bəndələrindən iman edib, xeyir əməl edənlərə Allah-Təala onu müjdə verir. (قُلْ لَٓا اَسْـَٔلُكُمْ عَلَيْهِ اَجْرًا اِلَّا الْمَوَدَّةَ فِي الْقُرْبٰىۜ) -** (Ey Məhəmməd), **insanlara de ki, mən peyğəmbərliyi təbliğ edib, Allah-Təalanın ehkamını sizə yetirməklə mənə soyda yaxın olan şəxsləri sevib, bu sevgidə sabit və bərqərar olmanızdan başqa sizdən heç* bir əcr və muzd istəmirəm.**

وَمَنْ يَقْتَرِفْ حَسَنَةً نَزِدْ لَهُ فِيهَا حُسْنًا اِنَّ اللّٰهَ غَفُورٌ شَكُورٌ ﴿٢٣﴾

***(*Qeyd:** "Dini təbliğ etmək üçün muzd istəməmək peyğəmbərlərin adətidir. Hər bir peyğəmbər gəlib xalqını haqq tərəfinə dəvət edəndə ilk sözü bu olubdur ki, sizdən heç bir dünya malı istəmirəm. Necə ki, həmin ayədə bizim uca peyğəmbərimizə Allah-Təala əmr edir: "Xalqa de ki, sizdən dünya malı istəmirəm ki, deyəsiniz, bəlkə o səbəbdən peyğəmbərlik iddiası edirsən. Lakin məqsədim Allah-Təalanın ehkamını sizə çatdırıb, sizi zəlalət və cəhalətdən qurtarmaqdır. Bu yol bizim uca peyğəmbərimizin yoludur və bunu özündən sonra ümmətinin nəsihətçi və vaizləri üçün təyin edib, Allah-Təalanın yanına köçdü. Bəs bu yol onun ümməti tərəfindən mülahizə olunub icra olunurmu? Bəs özlərini nəsihətçi və vaiz adlandıranlar nəfsani istəklərini bir kənara qoyub vəz və nəsihətlərini məhz Allahın məmnunluğuna məxsus edib, həqiqi kəlamı xalqa çatdırırlarmı? Heyhat, belə təmiz nəfs sahibi hanı və haradadır? Əgər islam ümmətinin nəsihətçiləri və vaizləri belə olsaydılar, bu nifaq və bu ədavət, bu məzhəb ixtilafı islam dünyasında zühur etməzdi. Əksinə, islam ümmətinin vaizlərinin əksəriyyəti vəz və nəsihəti özlərinə bir sənət və ruzi vasitəsi seçiblər. Belə halda necə nəfsani arzulardan keçib, batili tərk edib haqdan danışırlar? Əksinə, "tamahkar olan zəlil olar" ifadəsinin dairəsinə daxil olub, özlərini zillət və həqarətə düçar edib, az bir maaşdan ötrü yüz cür hiylə və yalan uydururlar ki, xalqın əlindəki dünya malından bir qədər də çox alsınlar. Ən təəccüblü budur ki, vaizlərin əksəriyyəti vəzlərində dünya malını xalqın nəzərində pisləyib, xəbis və murdar, leş adlandırırlar. Ta ki, var-dövlət sahiblərinin nəfsləri var-dövlətdən iyrənib, murdar şey kimi ondan imtina etsinlər. Elə ki, imtina etdilər, iri dəniz kimi dərhal onu udub, "Yenə də varmı?" deyə nərə çəkirlər. Bəs bu rəislər və bu vaiz və nəsihətçilərlə islam ümmətinin ittifaq və birlik halətində qalması mümkündürmü? İnsaf və mürüvvət sahibləri bu sözlərin haqlılığını əlbəttə iqrar edib, onların yayılmasına çalışacaqlar. Bu mübarək surə Məkkədə gəlib, ancaq dörd ayəsi Mədinədə nazil olub. Bu ayə də onlardandır. Zəməxşəri "Kəşşaf" təfsirində deyir: "Elə ki, ayə nazil oldu, sual verdilər: "Ey peyğəmbər, sənin qohumlarından olan bu şəxslər ki, Allah-Təala onları sevməyi bizə vacib sayıb, bəs onlar kimdir? Buyurdu: "Əli və Fatimeyi-Zəhra və iki oğlanları Həsən və Hüseyn. Ondan sonra Allahın Rəsulu buyurdu: "Kim ki, Məhəmməd və Məhəmmədin ailəsinin məhəbbəti ilə dünyadan getsə o şəxsi Allah-Təala bağışlayıb, dünyadan mömin gedibdir və kim ki, Məhəmməd və Məhəmmədin ailəsinə düşmənçilik və ədavət ilə dünyadan getsə, o şəxs qiyamət günündə elə bir halda gələr ki, onun iki gözünün arasında yazılar: "Bu şəxs Allah-Təalanın rəhmətindən uzaqdır. Hədis uzundur, bir-iki bəndi ilə kifayət edildi)."*

**(وَمَنْ يَقْتَرِفْ حَسَنَةً نَزِدْ لَهُ فِيهَا حُسْنًا اِنَّ اللّٰهَ غَفُورٌ شَكُورٌ) -** (Ey Məhəmməd), **kim bir xeyir əməl qazansa, biz o şəxsin əməlinin gözəlliyini daha da artırarıq və onun əməlindən artıq ona mükafat verərik. Həqiqətən, Allah-Təala tövbə**

اَمْ يَقُولُونَ افْتَرٰى عَلَى اللّٰهِ كَذِبًاۚ فَاِنْ يَشَاِ اللّٰهُ يَخْتِمْ عَلٰى قَلْبِكَۜ وَيَمْحُ اللّٰهُ الْبَاطِلَ وَيُحِقُّ الْحَقَّ بِكَلِمَاتِهٖۜ اِنَّهُ عَلٖيمٌ بِذَاتِ الصُّدُورِ ﴿٢٤﴾ وَهُوَ الَّذٖي يَقْبَلُ التَّوْبَةَ عَنْ عِبَادِهٖ وَيَعْفُوا عَنِ السَّيِّـَٔاتِ وَيَعْلَمُ مَا تَفْعَلُونَۙ ﴿٢٥﴾

---

**edənlərin günahını bağışlayıb, az saydakı əməllərinin də xeyrini qəbul edib, artırandır.**

**24) (اَمْ يَقُولُونَ افْتَرٰى عَلَى اللّٰهِ كَذِبًاۚ) -** (Ey Məhəmməd), **bəlkə müşriklər səndən ötrü deyirlər ki,** (Məhəmməd) **bu Quranı Allah-Təalaya iftira edib yalandan isnad edir? (فَاِنْ يَشَاِ اللّٰهُ يَخْتِمْ عَلٰى قَلْبِكَ) -** (Ey Məhəmməd), **əgər Allah-Təala istəsə sənin qəlbinə möhür vurub, qəlbinin nuru sönər, belə kəlam səndən zahir olmaz, o zaman Allah-Təalaya da iftira edə bilməzsən, amma sənin qəlbin nurani elm hikməti ilə dolu olub, özün ən uca hidayət dərəcəsində olduğun üçün belə kəlamlar səndən zühura gəlir. Necə sənə iftira etməyi isnad edirlər? (وَيَمْحُ اللّٰهُ الْبَاطِلَ وَيُحِقُّ الْحَقَّ بِكَلِمَاتِهٖۜ اِنَّهُ عَلٖيمٌ بِذَاتِ الصُّدُورِ) -** (Ey Məhəmməd), **müşriklərin sözləri və sənə iftira isnad etmələri hamısı batildir. Allah-Təala batili** (onların sözlərini və şirki) **məhv edib, islam dinini Qurani-Şərifdə nazil etdiyi kəlmələrlə sabit və bərqərar edər. Həqiqətən, Allah-Təala sinələrdə olan sirlərdən agahdır. Hər bir şəxsə ona görə qarşılıq verəcəkdir.**

**25) (وَهُوَ الَّذٖي يَقْبَلُ التَّوْبَةَ عَنْ عِبَادِهٖ وَيَعْفُوا عَنِ السَّيِّـَٔاتِ وَيَعْلَمُ مَا تَفْعَلُونَ) -** (Ey Məhəmməd), **Allah-Təala tövbə edən bəndələrinin* tövbəsini qəbul edib, onların günahlarından keçər, sizin kimi asi olub tövbə etməyənlərin etdiyi hər bir əməldən Allah-Təala agahdır, ona görə sizə cəza verəcəkdir.**

*(*__Qeyd:__ "Keçmiş pis əməllərə, fərzləri tərk etməyə peşman olmaq və dərhal onları tərk etmək və gələcəkdə pis əməlləri etməməyə niyyət etmək tövbədir. Cabir ibn Abdullah Ənsaridən rəvayət olunubdur, deyir ki, bədəvi bir şəxs gəlib Mədinədə Allah Rəsulunun məscidinə daxil olub namaza durub dedi: "İlahi, səndən əfv istəyib, pis əməllərdən tövbə edirəm. Ondan sonra təkbir deyib namaza daxil oldu. Əli cənabları orada hazır idilər. Elə ki o şəxs namazı bitirdi, Əli (ə.s) ona dedi: "Ey şəxs, dil ilə tez-tez tövbə edib, əfv istəmək yalançıların tövbəsidir. Sənin bu tövbənin başqa bir tövbəyə ehtiyacı var. O şəxs dedi: "Ey əmirəl-möminin, tövbə nədir?" Dedi: "Tövbənin 6 mənası var: 1) keçmiş günahlara peşman olmaq. 2) pis əməlləri tərk edib, edilməyən fərzləri yerinə yetirmək. 3) insanların haqqını sahibinə verib, ondan halallıq almaq. 4) nəfsi Allah-Təalanın itaətində zəlil etmək, 5) Allah-Təalaya itaət və ibadət etmənin acılığını nəfsə dadızdırmaq, necə ki, günahın şirinliyini dadızdırmışdın. 6) hər bir günahda şad olub gülmək əvəzinə ağlamaq. Bu 6 şey yerinə yetirilərsə, tövbə həqiqi tövbə olar. Bəs biz müsəlmanlar içində hansı*

وَيَسْتَجِيبُ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ وَيَزِيدُهُمْ مِنْ فَضْلِهِ وَالْكَافِرُونَ لَهُمْ عَذَابٌ شَدِيدٌ
﴿٢٦﴾ وَلَوْ بَسَطَ اللّٰهُ الرِّزْقَ لِعِبَادِهِ لَبَغَوْا فِي الْاَرْضِ وَلٰكِنْ يُنَزِّلُ بِقَدَرٍ مَا يَشَٓاءُ اِنَّهُ بِعِبَادِهِ خَبِيرٌ بَصِيرٌ ﴿٢٧﴾

---

*tövbəkardır ki, əmirəl-mömininin fərmanına tabe olub, günahdan sonra bu cür tövbə etsin? Əgər həqiqətən, o cür tövbə olunsa müsəlmanlar arasında zülm, fəsad, hər növ pislik, necə ki, bu zamanda düçar olublar, heç biri peyda olmaz. İslam ümmətini fəlakət gününə salıb, vəhşi heyvan kimi edən şey din və millət rəislərinin haqq və doğru sözlərinə qulaq verməyib, batil və yalan, nəfsani arzulara müvafiq olan sözlərə itaət etməsindən qaynaqlanır. Demək olar ki, bu zamanda islam ümmətinin əksər ayin və adətlərinin əsası Qurana zidd olan yalan-palan üzərinə qurulubdur. Bununla belə, heç veclərinə olmayıb, bu yalan-palanı haqq hesab edib, Qurana zidd olan əməllərini qəribə yozumlarla izah edirlər. İslam ümməti haqqında bəyan etdiyim eyiblərə hərçənd tənə edib, iftira atdığımı deyəcəklər. Lakin elm və insaf əhli şəxslərdən xahiş və təvəqqe edirəm, Qurani-Şərifdə qeyd olunan fərz ehkamlarla bizim aramızda istifadə edilən ehkamı müqayisə etsinlər. O vaxt mən həqirin sözlərinin doğruluğu aydın olar. Əgər desən ki, o ehkam rəvayətlərlə sabit olubdur. Cavabında deyərəm ki, dərdimizin dərmansızlığı elə odur. Görəsən, Qurani-Şərifin ziddini deyən rəvayətlərə əməl etmək islamın qanunu imiş? Necə ki, Allah ondan razı olub, rəhm etsin, şeyximiz əl-Bəhai "Qəsideyi-ğarra"sında Quran ayələri kimi göstərilən yəhudi rəvayətləri haqqında belə deyir: "rəvayət edirik deyə ayələri pozurlar, onu Əbu Şa`bun Kə`b əl-Əxbardan rəvayət etdi deyirlər". Bu şeir işıq ilə cənnət hurilərinin alnına yazılsa layiqdir. Allah onların uydurduqları yalanlardan ucadır).*

**26) (وَيَسْتَجِيبُ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ وَيَزِيدُهُمْ مِنْ فَضْلِهِ) - Allah-Təala iman edib, xeyir əməl edən şəxslərin dualarını qəbul edib, istədikləri əcr və savabı onlara verib,mərhəmət və rəhmətindən onlara daha çox bəxş edər. (وَالْكَافِرُونَ لَهُمْ عَذَابٌ شَدِيدٌ) Amma kafirlərdən ötrü qiyamət günündə şiddətli əzab vardır.**

**27) (وَلَوْ بَسَطَ اللّٰهُ الرِّزْقَ لِعِبَادِهِ لَبَغَوْا فِي الْاَرْضِ) -** (Ey Məhəmməd), **Allah-Təala ruzini insanlar arasında hikmət üzrə qismət edər, əgər Allah-Təala ruzini bəndələrindən ötrü bol edib, hamısını varlı etsə, hər halda yer üzündə təkəbbürlənib, zülm və fəsad çıxarıb, bir-birləri ilə qovğa edərdilər. Hamısı var- dövlət sahibi olduğu üçün bir-birilərinə üstün olmağa çalışıb, hər biri özünü rəis etmək istəyərdi. (وَلٰكِنْ يُنَزِّلُ بِقَدَرٍ مَا يَشَٓاءُ اِنَّهُ بِعِبَادِهِ خَبِيرٌ بَصِيرٌ) - Lakin Allah-Təala öz hikməti və məsləhəti üzrə bəndələrindən ötrü təqdir etdiyi qədər hər bir şəxsə müvafiq ruzi göndərir, həqiqətən, Allah-Təala bəndələrinin əhvalından agahda və görəndir. Birini kasıb, digərini varlı edib, birinə çox, birinə az verir. Heç bir şəxsdən ötrü Allah-Təalanın hikmətinin müqabilində danışmaq layiq deyildir.**

وَهُوَ الَّذٖي يُنَزِّلُ الْغَيْثَ مِنْ بَعْدِ مَا قَنَطُوا وَيَنْشُرُ رَحْمَتَهُ ۜ وَهُوَ الْوَلِيُّ الْحَمٖيدُ ﴿٢٨﴾ وَمِنْ اٰيَاتِهٖ خَلْقُ
السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَثَّ فٖيهِمَا مِنْ دَآبَّةٍ ۜ وَهُوَ عَلٰى جَمْعِهِمْ اِذَا يَشَآءُ قَدٖيرٌ ۟ ﴿٢٩﴾ وَمَآ اَصَابَكُمْ مِنْ
مُصٖيبَةٍ فَبِمَا كَسَبَتْ اَيْدٖيكُمْ وَيَعْفُوا عَنْ كَثٖيرٍ ۜ ﴿٣٠﴾ وَمَآ اَنْتُمْ بِمُعْجِزٖينَ فِي الْاَرْضِ ۚ وَمَا لَكُمْ مِنْ دُونِ
اللّٰهِ مِنْ وَلِيٍّ وَلَا نَصٖيرٍ ﴿٣١﴾

---

**28) (وَهُوَ الَّذٖي يُنَزِّلُ الْغَيْثَ مِنْ بَعْدِ مَا قَنَطُوا وَيَنْشُرُ رَحْمَتَهُ ۜ وَهُوَ الْوَلِيُّ الْحَمٖيدُ)** - (Ey Məhəmməd), **insanlar arasında qəhətlik yayılıb, həyatlarından naümid olandan sonra Allah-Təala öz kamil qüdrəti ilə yağış göndərib rəhmətini** (yağışın bərəkət və faydasını) **xalq arasında yayar ki, hamısı faydalansın. İnsanların işlərində ilk ixtiyar sahib olub, həmd-səna olunmağa yeganə qüdrət sahibi olan Allah-Təala layiqdir.**

**29) (وَمِنْ اٰيَاتِهٖ خَلْقُ السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَثَّ فٖيهِمَا مِنْ دَآبَّةٍ ۜ)** - (Ey Məhəmməd), **göylərin və yerin yaradılması və Allah-Təalanın onlarda* hərəkət edən məxluqatı meydana gətirib yayması yaradıcının kamil qüdrətinə işarə edən dəlil və sübutlardandır.**

***(*Qeyd:** “Bu zamanda elmin fövqəladə gücü ilə sonsuz fəzada vaqe olan kürələrdə hər bir növ məxluqatın varlığına inanan astronomların sözünün doğruluğuna bu ayə açıq dəlil və möhkəm sübutdur. Ar olsun islam ümmətinə, Qərb alimləri Quran ayələrinin möcüzəli bəyanlarının mənasını kəşf edib, bir çox faydalara çatıblar. Biz Quran əhli isə bundan məhrum qalıb, belə ayələr oxunanda ki, göydə məxluq olmağa işarə edir, ayəyə göyərçin, bildirçin, qarğa kimi uçan quşların mənasını verib, məlaikənin həqiqi mənasından qafil olub, məlaikə adından başqa söz deyəni təkfir edirik. Bundan da artıq axmaqlıq olarmı?)*

**(وَهُوَ عَلٰى جَمْعِهِمْ اِذَا يَشَآءُ قَدٖيرٌ) - Allah-Təala nə zaman istəsə, göy və yerin məxluqatını bir yerə cəm etməyə qadirdir.**

**30) (وَمَآ اَصَابَكُمْ مِنْ مُصٖيبَةٍ فَبِمَا كَسَبَتْ اَيْدٖيكُمْ وَيَعْفُوا عَنْ كَثٖيرٍ ۜ) - Siz insan nəslinə gələn hər bir müsibət əllərinizlə qazandığınız günahlar səbəbi ilədir. Halbuki Allah-Təala bir çox günahlardan keçib, onların səbəbinə dünyada sizə bir bəla, müsibət vermir.**

**31) (وَمَآ اَنْتُمْ بِمُعْجِزٖينَ فِي الْاَرْضِ ۚ) - Ey insan nəsli, yer üzündə qaçıb məndən qurtulan deyilsiniz, əksinə, mənim qüdrətimə tabe olub, mənim əzabımdan xilas ola bilməyəcəksiniz. Gəlin mənə itaət edin.**

**(وَمَا لَكُمْ مِنْ دُونِ اللّٰهِ مِنْ وَلِيٍّ وَلَا نَصٖيرٍ) - Mən ki, sizin məbudunuzam, məndən başqa sizə rəhm edib, işlərinizi görən, nə də sizə bir kömək edən olmaz ki, sizi əzabından xilas etdin.**

وَمِنْ اٰيَاتِهِ الْجَوَارِ فِي الْبَحْرِ كَالْاَعْلَامِۜ ﴿٣٢﴾ اِنْ يَشَاْ يُسْكِنِ الرّٖيحَ فَيَظْلَلْنَ رَوَاكِدَ عَلٰى ظَهْرِهٖۜ اِنَّ
فٖي ذٰلِكَ لَاٰيَاتٍ لِكُلِّ صَبَّارٍ شَكُورٍۙ ﴿٣٣﴾ اَوْ يُوبِقْهُنَّ بِمَا كَسَبُوا وَيَعْفُ عَنْ كَثٖيرٍۘ ﴿٣٤﴾ وَيَعْلَمَ
الَّذٖينَ يُجَادِلُونَ فٖٓي اٰيَاتِنَاۜ مَا لَهُمْ مِنْ مَحٖيصٍ ﴿٣٥﴾ فَمَٓا اُوتٖيتُمْ مِنْ شَيْءٍ فَمَتَاعُ الْحَيٰوةِ الدُّنْيَاۚ وَمَا
عِنْدَ اللّٰهِ خَيْرٌ وَاَبْقٰى لِلَّذٖينَ اٰمَنُوا وَعَلٰى رَبِّهِمْ يَتَوَكَّلُونَۚ ﴿٣٦﴾

---

**32-33) (وَمِنْ اٰيَاتِهِ الْجَوَارِ فِي الْبَحْرِ كَالْاَعْلَامِۜ) - Allah-Təalanın kamil qüdrətinə işarə edən dəlil və sübutlardan biri də dağlar kimi dənizdə üzən gəmilərdir. Allah-Təala* külək göndərir, küləyin səbəbinə gəmilər hər bir tərəfə hərəkət edərlər.**

*(***Qeyd:** "Hərçənd bu zamanda buxarlı gəmilərin zahirən küləyə ehtiyacı olmayıb, buxarın gücü ilə hər bir tərəfə üzürlər, lakin bununla belə həqiqətən, hər bir iri gəminin küləyə ehtiyacı vardır. Çünki küləyin əks hərəkətindən gəmilərə xətər dəyməsi şübhəsizdir. Onun şəfqəti və qüdrəti nə böyükdür).*

**(اِنْ يَشَاْ يُسْكِنِ الرّٖيحَ فَيَظْلَلْنَ رَوَاكِدَ عَلٰى ظَهْرِهٖۜ) - Əgər Allah-Təala istəsə, küləyi sakit edib, gəmilər dəniz üstündə sabit durub heç bir tərəfə hərəkət etməyib, gəmilərin içindəki müsafirlər onların hərəkət etməsi üçün heç bir çarə tapmazlar. (اِنَّ فٖي ذٰلِكَ لَاٰيَاتٍ لِكُلِّ صَبَّارٍ شَكُورٍۙ) - Həqiqətən, gəmilərin külək səbəbi ilə hərəkət etməsində Allah-Təalanın bəlasına səbir edib, nemətlərinə şükür edənlərdən ötrü dəlil və sübutlar vardır.**

**34-35) (اَوْ يُوبِقْهُنَّ بِمَا كَسَبُوا وَيَعْفُ عَنْ كَثٖيرٍۘ) - Ya da ki, Allah-Təala küləyə şiddətlə hərəkət verib (buxarlı və qeyri-buxarlı) gəminin içində olan müsafirlərin qazandıqları günah səbəbi ilə gəmiləri qərq edib, bəzisini həlak edib, bir çoxunun da günahından keçib nicat verər.**

**(وَيَعْلَمَ الَّذٖينَ يُجَادِلُونَ فٖٓي اٰيَاتِنَاۜ مَا لَهُمْ مِنْ مَحٖيصٍ)** - (Ey Məhəmməd), **bizim tövhid və qüdrətimizə işarə edən dəlil və sübutları batil etmək üçün mücadilə edənlər onlara əzab gələn vaxt agah olacaqlar ki, onlardan ötrü bizim əzabımızdan qaçıb xilas olmaq mümkün olmayacaqdır. O vaxt peşman olacaqlar. Lakin peşman olmaq onlara fayda verməz.**

**36) (فَمَٓا اُوتٖيتُمْ مِنْ شَيْءٍ فَمَتَاعُ الْحَيٰوةِ الدُّنْيَاۚ) - Hər bir şey ki, dünyanın mal və zinətlərindən siz insan nəslinə verilibdir, onlar hamısı dünya həyatının müvəqqəti mənfəətidir, fani olacaqdır.**

**(وَمَا عِنْدَ اللّٰهِ خَيْرٌ وَاَبْقٰى لِلَّذٖينَ اٰمَنُوا وَعَلٰى رَبِّهِمْ يَتَوَكَّلُونَۚ) - Amma Allah-Təalanın yanında olan əcr və savab Allah-Təalaya iman edib, təvəkkül edənlərdən ötrü daha yaxşı və əbədidir. Həmişə olub fani olmayacaqdır. Ağıllı şəxs fanini əbədiyə üstün sayarmı?**

وَالَّذِينَ اسْتَجَابُوا لِرَبِّهِمْ وَاَقَامُوا الصَّلٰوةَ ۖ وَاَمْرُهُمْ شُورٰى بَيْنَهُمْ ۖ وَمِمَّا رَزَقْنَاهُمْ يُنْفِقُونَ ۚ ﴿٣٨﴾
وَالَّذِينَ يَجْتَنِبُونَ كَبَٓائِرَ الْاِثْمِ وَالْفَوَاحِشَ وَاِذَا مَا غَضِبُوا هُمْ يَغْفِرُونَ ۚ ﴿٣٧﴾

---

**37) (وَالَّذِينَ يَجْتَنِبُونَ كَبَٓائِرَ الْاِثْمِ وَالْفَوَاحِشَ) - Yenə axirət savabı o şəxslərdən ötrüdür ki, böyük günahlardan çəkinsinlər. (وَاِذَا مَا غَضِبُوا هُمْ يَغْفِرُونَ) O zaman ki, qəzəbləndilər, qəzəblərini udub, bağışlamağa çalışıb, bağışlasınlar.**

**38) (وَالَّذِينَ اسْتَجَابُوا لِرَبِّهِمْ وَاَقَامُوا الصَّلٰوةَ ۖ وَاَمْرُهُمْ شُورٰى بَيْنَهُمْ ۖ وَمِمَّا رَزَقْنَاهُمْ يُنْفِقُونَ) - Yenə axirət savabı o şəxslərdən ötrüdür ki, öz rəbləri Allah-Təalanın dəvətini qəbul edib, iman edib, şirki tərk edib, namaz qılıb, aralarındakı* hər bir ümummilli işi şura ilə edib, təkbaşına heç bir işə başlamazlar, bizim onlara verdiyimiz ruzilərdən bizim yolumuzda ümmətin övladlarının xeyir və yaxşılığı üçün xərcləyib sərf edərlər.**

***(*Qeyd:** “Bu ayəyə diqqət olunsun ki, necə də Allah-Təala hər bir işdə şuranı axirət nicatının səbəblərindən təyin edib, tövhid və ibadətlə bir sırada onu qeyd edir, bu, şuranın böyük dərəcədə faydasına və ucalığına işarədir. Həsən Bəsri deyibdir: “Hər bir xalq və camaat ki, işlərini müşavirə ilə etsə, o camaat işlərində doğrunu və xeyri tapıb, hidayətə çatar. Uca peyğəmbərimiz də hədisində buyurubdur: “Tələsmək şeytandan, işi ehtiyatla etmək isə Rəhmandandır.” Bu, həmin şuraya işarədir. Allah-Təala Qurani-Şərifdə bir çox ayədə şuranı əmr edib və əhəmiyyətini bəyan edəndən sonra hədis və digər sözlərlə bunu anlatmağa hərçənd ehtiyac yoxdur. Lakin Allahın Rəsuluna (ə.s) və ondan sonra uca səhabələrin tarix əhvalatlarına agah olanlara onların hər bir işi şura ilə həll etməsi məxfi deyildir. Belə bir böyük əmr ki, Qərb əhli onunla iftixar edib, özlərini bu müqəddəs əmrin banisi hesab edirlər, hansı ki, o zaman Qərb əhli vəhşi heyvanat kimi hər bir elmdən uzaq olub, cəhalət onların arasında yayğın ikən, bu əmrin əsası Quranın şəhadəti ilə islam dinində qoyulubdur, bəs necə biz islam ümməti tərəfindən tərk olunubdur, belə bir uca və müqəddəs əmrin islam ümməti arasından tərkinə səbəb nədir? İslam ümmətinin dünya və axirət nicatı Qurani-Şərifin tabe olunması vacib olan ehkamına yapışmaqdadır. Biz islam ümmətinin bədbəxtliyi bundadır ki, islam şəriətinin sahibinin Quran ilə təyin etdiyi qanunları dərk edib anlamaqdan gözümüzü kor, qəlbimizi qafil etmişik. Lakin həmin qanunların oxşarını özgə millətlər uzun zamanın keçməsi ilə fövqəladə zəhmətlərlə meydana gətiriblər. Bəlkə də əksəriyyətini Qurani-Şərifdən götürüb, ürəkdən qəbul edib, öz ruhları kimi yaxın hesab ediblər. Daha bundan da artıq cəhalət və axmaqlıq olarmı? Heyhat, bu ümmət nicat tapıb, keçmiş günlərdəki kimi müvəffəq olacaqmı? Heyhat, Qurani-Şərifin ehkamı tərk edildikcə, bu ümmət fəlakət və zəlalət günündə qalacaqdır. Allahım, bizi birləşdir, kitabına iman etməyə hidayət et!)*

وَالَّذِينَ اِذَٓا اَصَابَهُمُ الْبَغْيُ هُمْ يَنْتَصِرُونَ﴿٣٩﴾ وَجَزٰٓؤُا سَيِّئَةٍ سَيِّئَةٌ مِثْلُهَاۚ فَمَنْ عَفَا وَاَصْلَحَ فَاَجْرُهُ
عَلَى اللّٰهِۜ اِنَّهُ لَا يُحِبُّ الظَّالِمِينَ ﴿٤٠﴾ وَلَمَنِ انْتَصَرَ بَعْدَ ظُلْمِهِ فَاُو۬لٰٓئِكَ مَا عَلَيْهِمْ مِنْ سَبِيلٍۜ
﴿٤١﴾ اِنَّمَا السَّبِيلُ عَلَى الَّذِينَ يَظْلِمُونَ النَّاسَ وَيَبْغُونَ فِي الْاَرْضِ بِغَيْرِ الْحَقِّۜ اُو۬لٰٓئِكَ لَهُمْ عَذَابٌ
اَلِيمٌ﴿٤٢﴾ وَلَمَنْ صَبَرَ وَغَفَرَ اِنَّ ذٰلِكَ لَمِنْ عَزْمِ الْاُمُورِۚ﴿٤٣﴾

---

**39) (وَالَّذِينَ اِذَٓا اَصَابَهُمُ الْبَغْيُ هُمْ يَنْتَصِرُونَ) - Axirət savabı o şəxslərdən ötrüdür ki, o zaman ki onlara zülm edildi, zalımdan Allah-Təalanın qoyduğu qanunla intiqam alıb, həddi aşmazlar.**

**40) (وَجَزٰٓؤُا سَيِّئَةٍ سَيِّئَةٌ مِثْلُهَاۚ) - Zülm olunan şəxs zalımdan əvəz almaq istəsə, o zülmün, əvəzi, gərək onun eyni qədər olsun. Ondan artıq əvəz ala bilməz. (فَمَنْ عَفَا وَاَصْلَحَ فَاَجْرُهُ عَلَى اللّٰهِۜ اِنَّهُ لَا يُحِبُّ الظَّالِمِينَ) - Kim ki, zülmün əvəzini verməyib, zalımı əfv edib, onunla arasını düzəltsə,** (əlbəttə, intiqam almaqdansa, əfv etmək yaxşıdır) **onun əcri-savabı Allah-Təalaya aiddir. Ola bilər ki, intiqam alarkən həddi aşa, o vaxt da məzlum olandan sonra zalım olar. Həqiqətən, Allah-Təala zalımları sevməz. İntiqam almaqdansa, əfv etmək yaxşıdır.**

**41) (وَلَمَنِ انْتَصَرَ بَعْدَ ظُلْمِهِ فَاُو۬لٰٓئِكَ مَا عَلَيْهِمْ مِنْ سَبِيلٍۜ) - Amma kim məzlum olandan sonra intiqam almaq istəyib, zülm olunan qədər zalımdan intiqam alsa, onlara eyib tutub, töhmət edib və ya əzab etməyə heç bir şəxsə yol yoxdur. Çünki öz haqlarını alıblar.**

**42) (اِنَّمَا السَّبِيلُ عَلَى الَّذِينَ يَظْلِمُونَ النَّاسَ وَيَبْغُونَ فِي الْاَرْضِ بِغَيْرِ الْحَقِّ) - Əksinə, o şəxslərə eyib edib əzab etməyə yol vardır ki, səbəbsiz yerə əvvəlcə xalqa zülm edib, yer üzündə haqq və ədalətdən kənar təkəbbürlənib, fəsad çıxartsınlar. Belə şəxslərə gərək əzab olunub, onların zülmü gərək xalqdan dəf olunsun. (اُو۬لٰٓئِكَ لَهُمْ عَذَابٌ اَلِيمٌ) - Onlardan ötrü axirətdə əziyyət verən əzab vardır.**

**43) (وَلَمَنْ صَبَرَ وَغَفَرَ اِنَّ ذٰلِكَ لَمِنْ عَزْمِ الْاُمُورِۚ)*- Amma kim zülmə səbir edib, zalımdan intiqam almayıb bağışlasa, həqiqətən, səbir edib bağışlamaq ağıllı şəxslərə layiq işlərdəndir. Gərək, belə işlərə əzm edib, təşəbbüs etsinlər.**

*(***Qeyd:** "Həsən Bəsrinin məclisində bir şəxs digər bir şəxsi söyüb, nalayiq sözlər dedi. O şəxs qəzəbini saxlayıb, tərləyib, üzündən tər axdı. Tərini silib, ayağa durub, həmin ayəni oxudu. Həsən dedi: "And olsun Allah-Təalaya, cahillər bu ayəni zay ediblər. Bu şəxs bu ayəni anlayıb həqiqətini dərk etdi, bağışlayıb keçmək savab və gözəl işdir. Lakin vaxt gələr ki, bunun əksi olar, əvəz edib intiqam almaq doğru olar. Məsələn, o zaman ki, zalımdan əvəz alınmayanda, həddini aşa, amma əvəz alınanda zülmü tərk edib sülh və xeyrə yönələ, belə vaxtda əvəzini verməк lazımdır. Bu mətləbə sübut budur: "Alla-*

وَمَنْ يُضْلِلِ اللّٰهُ فَمَا لَهُ مِنْ وَلِيٍّ مِنْ بَعْدِهِ ۜ وَتَرَى الظَّالِمِينَ لَمَّا رَاَوُا الْعَذَابَ يَقُولُونَ هَلْ اِلٰى مَرَدٍّ مِنْ
سَبِيلٍ ۚ ﴿٤٤﴾ وَتَرٰيهُمْ يُعْرَضُونَ عَلَيْهَا خَاشِعِينَ مِنَ الذُّلِّ يَنْظُرُونَ مِنْ طَرْفٍ خَفِيٍّ ۗ وَقَالَ الَّذٖينَ اٰمَنُوٓا
اِنَّ الْخَاسِرٖينَ الَّذٖينَ خَسِرُوٓا اَنْفُسَهُمْ وَاَهْلٖيهِمْ يَوْمَ الْقِيٰمَةِ ۜ اَلَآ اِنَّ الظَّالِمٖينَ فٖي عَذَابٍ مُقٖيمٍ ﴿٤٥﴾
وَمَا كَانَ لَهُمْ مِنْ اَوْلِيَآءَ يَنْصُرُونَهُمْ مِنْ دُونِ اللّٰهِ ۗ وَمَنْ يُضْلِلِ اللّٰهُ فَمَا لَهُ مِنْ سَبٖيلٍ ۜ ﴿٤٦﴾ اِسْتَجٖيبُوا
لِرَبِّكُمْ مِنْ قَبْلِ اَنْ يَاْتِيَ يَوْمٌ لَا مَرَدَّ لَهُ مِنَ اللّٰهِ ۜ

---

*hın Rəsulunun (ə.s) hüzurunda o cənabın pak xanımlarından Zeynəb Cəhş qızı Aişəyə nalayiq sözlər dedi. (Necə ki, qadınlar arasında, xüsusən günülər arasında vaqe olur), o cənab Zeynəbə danışmağı qadağan edib, sükutu əmr etdi. Zeynəb sakit olmadı. O vaxt da Aişəyə buyurdu: "Sən də əvəzində intiqam al).*

**44) (وَمَنْ يُضْلِلِ اللّٰهُ فَمَا لَهُ مِنْ وَلِيٍّ مِنْ بَعْدِهِ) - Hər bir şəxsi ki, Allah-Təala öz xəbis əməli səbəbi ilə zəlalətdə qoya, ondan sonra o şəxsdən ötrü kömək edib, onu zəlalətdən xilas edən ola bilməz.**

**(وَتَرَى الظَّالِمِينَ لَمَّا رَاَوُا الْعَذَابَ يَقُولُونَ هَلْ اِلٰى مَرَدٍّ مِنْ سَبِيلٍ) -** (Ey Məhəmməd), **qiyamət günündə zalımları görərsən, o zaman ki, əzabı gördülər, deyərlər: "Görəsən, dünyaya qayıtmağa bizdən ötrü bir yol vardırmı ki, dünyaya qayıdıb xeyir əməl edək.** (Dünyaya qayıtmağı arzu edərlər, amma qayıtmaq onlardan ötrü mümkün olmaz).

**45) (وَتَرٰيهُمْ يُعْرَضُونَ عَلَيْهَا خَاشِعِينَ مِنَ الذُّلِّ يَنْظُرُونَ مِنْ طَرْفٍ خَفِيٍّ) -** (Ey Məhəmməd), **qiyamət günündə zalımları görərsən, cəhənnəmə tərəf aparılıb, cəhənnəm odunu görəndə zillətdən gözləri kiçilib, zəif halətdə əzab qorxusundan cəhənnəm tərəfinə gizlincə gözlərinin ucu ilə baxarlar.** (Necə ki hər bir şəxs qorxunc şeylərə elə baxar).

**46) (وَقَالَ الَّذٖينَ اٰمَنُوٓا اِنَّ الْخَاسِرٖينَ الَّذٖينَ خَسِرُوٓا اَنْفُسَهُمْ وَاَهْلٖيهِمْ يَوْمَ الْقِيٰمَةِ) - Elə ki, iman edən şəxslər qiyamət günündə zalımları o halda gördülər, deyərlər: "Həqiqətən, əsl ziyankarlar o şəxslərdir ki, xəbis əməlləri səbəbi ilə qiyamət günündə öz nəfslərinə ziyan vurub, cəhənnəmə daxil oldular və ailələrinə də ziyan verib, onları pis əməllərə vadar etmək səbəbi ilə onları da cəhənnəmə daxil etdilər." (اَلَآ اِنَّ الظَّالِمٖينَ فٖي عَذَابٍ مُقٖيمٍ) -** (Ey Məhəmməd), **xəbərdar ol ki, həqiqətən zalımlar həmişəlik əzab içində olacaqlar.**

**46) (وَمَا كَانَ لَهُمْ مِنْ اَوْلِيَآءَ يَنْصُرُونَهُمْ مِنْ دُونِ اللّٰهِ) -** (Ey Məhəmməd), **zalımlara Allah-Təaladan başqa kömək edən olmaz ki, əzabdan xilas olsunlar. (وَمَنْ يُضْلِلِ اللّٰهُ فَمَا لَهُ مِنْ سَبٖيلٍ) - Hər bir şəxsi ki xəbis əməlinin səbəbi ilə Allah-Təala zəlalətdə qoya, ondan ötrü haqq tərəfinə hidayət tapmağa daha bir yol olmayıb, dünya və axirətdə zəlalətdə olacaqdır.**

**47) (اِسْتَجٖيبُوا لِرَبِّكُمْ مِنْ قَبْلِ اَنْ يَاْتِيَ يَوْمٌ لَا مَرَدَّ لَهُ مِنَ اللّٰهِ) - Ey insan, elə bir gün ki (qiyamət günü) onun əzabına hökm olunandan sonra daha Allah-Tə-**

مَا لَكُمْ مِنْ مَلْجَاٍ يَوْمَئِذٍ وَمَا لَكُمْ مِنْ نَكِيرٍ ﴿٤٧﴾ فَاِنْ اَعْرَضُوا فَمَٓا اَرْسَلْنَاكَ عَلَيْهِمْ حَفِيظًاۜ اِنْ عَلَيْكَ اِلَّا الْبَلَاغُۜ وَاِنَّٓا اِذَٓا اَذَقْنَا الْاِنْسَانَ مِنَّا رَحْمَةً فَرِحَ بِهَاۚ وَاِنْ تُصِبْهُمْ سَيِّئَةٌ بِمَا قَدَّمَتْ اَيْدِيهِمْ فَاِنَّ الْاِنْسَانَ كَفُورٌ ﴿٤٨﴾ لِلّٰهِ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ يَخْلُقُ مَا يَشَٓاءُۜ يَهَبُ لِمَنْ يَشَٓاءُ اِنَاثًا وَيَهَبُ لِمَنْ يَشَٓاءُ الذُّكُورَۙ ﴿٤٩﴾ اَوْ يُزَوِّجُهُمْ ذُكْرَانًا وَاِنَاثًاۚ وَيَجْعَلُ مَنْ يَشَٓاءُ عَقِيمًاۜ اِنَّهُ عَلِيمٌ قَدِيرٌ ﴿٥٠﴾ وَمَا كَانَ لِبَشَرٍ اَنْ يُكَلِّمَهُ اللّٰهُ

---

**aladan o əzabın qayıtmağına hökm olunmayacaq, o gün sizə gəlmədən əvvəl nə qədər ki dünyada varsınız, fürsət sizdədir, rəbbiniz Allah-Təalanın peyğəmbəri Məhəmmədin dəvətini qəbul edib müvəhhid olun. (**مَا لَكُمْ مِنْ مَلْجَاٍ يَوْمَئِذٍ وَمَا لَكُمْ مِنْ نَكِيرٍ**) - Sizdən ötrü qiyamət günündə Allah-Təalanın əzabından nə bir sığınacaq olmaz ki, oraya pənah aparıb amanda olasınız nə də sizdən ötrü etdiyiniz əməlləri inkar etmək mümkün olmaz ki, inkar edib əzabdan xilas olasınız, heç olmazsa, belə bir günün qorxusundan imana daxil olun.**

**48) (**فَاِنْ اَعْرَضُوا فَمَٓا اَرْسَلْنَاكَ عَلَيْهِمْ حَفِيظًاۜ اِنْ عَلَيْكَ اِلَّا الْبَلَاغُ**) -** (Ey Məhəmməd), **əgər xalq səndən üz döndərib, sənə itaət etməsə, etməsin. Biz səni onların əməllərini mühafizə etməyə göndərməmişik. Sənə peyğəmbərliyi təbliğ etməkdən başqa, heç bir şey lazım deyildir. (**وَاِنَّٓا اِذَٓا اَذَقْنَا الْاِنْسَانَ مِنَّا رَحْمَةً فَرِحَ بِهَا**) - Həqiqətən, o zaman ki biz asi və günahkar insanlara öz tərəfimizdən nemət dadızdırdıq, o nemətə şad olub, tüğyan edib, daha bizə şükür etməzlər. (**وَاِنْ تُصِبْهُمْ سَيِّئَةٌ بِمَا قَدَّمَتْ اَيْدِيهِمْ فَاِنَّ الْاِنْسَانَ كَفُورٌ**) - Lakin əgər asilərə xəbis əməllərinin səbəbi ilə bir bəla və müsibət yetişsə, həqiqətən, o vaxt da nemətləri unudub, Allah-Təalaya kafir olarlar. Həqiqətən, insan nankorluq edəndir.**

**49) (**لِلّٰهِ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ يَخْلُقُ مَا يَشَٓاءُۜ يَهَبُ لِمَنْ يَشَٓاءُ**) - Göylərin və yerin hakimiyyəti Allah-Təalaya məxsusdur. Hər bir növ məxluq istəsə yaradar. Heç bir nəfər onun istəyinə və iradəsinə mane ola bilməz.**

**(**اِنَاثًا وَيَهَبُ لِمَنْ يَشَٓاءُ الذُّكُورَۙ**) - Hər bir şəxsə istəsə hikmətinə uyğun olaraq qız bağışlar. Daha oğul verməz və hər bir şəxsə istəsə hikmətinə uyğun olaraq oğul bağışlar. Daha qız verməz. Oğul, qız vermək insanların istəyi ilə deyildir. Əksinə, Allah-Təalanın hikməti ilədir.**

**50) (**اَوْ يُزَوِّجُهُمْ ذُكْرَانًا وَاِنَاثًاۚ**) - Ya da ki istəsə, həm oğul, həm də qız verər. (**وَيَجْعَلُ مَنْ يَشَٓاءُ عَقِيمًاۜ اِنَّهُ عَلِيمٌ قَدِيرٌ**) - Və hər bir şəxsi istəsə, övladsız edər, daha onun övladı olmaz. Həqiqətən, Allah-Təala bəndələrinin faydasına müvafiq hər bir şeyin icadına qadirdir.**

**51) (**وَمَا كَانَ لِبَشَرٍ اَنْ يُكَلِّمَهُ اللّٰهُ**) -** (Ey Məhəmməd), **insanlardan heç bir nəfər yoxdur və doğru da deyil ki, Allah-Təala onunla** (necə ki, onlar bir-biri ilə

اِلَّا وَحْيًا اَوْ مِنْ وَرَآئِ حِجَابٍ اَوْ يُرْسِلَ رَسُولًا فَيُوحِيَ بِاِذْنِهِ مَا يَشَآءُ اِنَّهُ عَلِيٌّ حَكِيمٌ ﴿٥١﴾
وَكَذٰلِكَ اَوْحَيْنَآ اِلَيْكَ رُوحًا مِنْ اَمْرِنَا مَا كُنْتَ تَدْرِي مَا الْكِتَابُ وَلَا الْاِيمَانُ وَلٰكِنْ جَعَلْنَاهُ نُورًا
نَهْدِي بِهِ مَنْ نَشَآءُ مِنْ عِبَادِنَا وَاِنَّكَ لَتَهْدِيَ اِلٰى صِرَاطٍ مُسْتَقِيمٍ ﴿٥٢﴾

---

danışır) **danışsın.** (Allah-Təalanın danışmağı ancaq üç yoldan biri ilə olar). **(اِلَّا وَحْيًا) - Birincisi - vasitəsiz və vəhy vasitəsilə olur.** (Vəhy də iki qisim olur, ya bir şeyi Allah-Təala şəxsin qəlbinə salır, ağıl vasitəsi ilə o şeyi dərk edir, necə ki, Musanın anasının qəlbinə saldı ki, onu Nil çayına atsın və ya yuxuda görməklə olur, necə ki, döğru və nəticəsi məlum olan yuxular bu mətləbə şahiddir). **(اَوْ مِنْ وَرَآئِ حِجَابٍ) - İkincisi-pərdə dalından danışar,** (Danışdığı şəxs Allah-Təalanın kəlamını eşidib, özünü görə bilməz. Necə ki, Musa ilə danışırdı). **Pərdə misal verməkdən ötrüdür, yəni Allah-Təala kəlamını istədiyi şəxsə yetirər, lakin o şəxs Allah-Təalanı görə bilməz.**

**(اَوْ يُرْسِلَ رَسُولًا فَيُوحِيَ بِاِذْنِهِ مَا يَشَآءُ) - Üçüncüsü - Allah-Təala öz tərəfindən bir elçi (mələk) göndərər. O mələk Allah-Təalanın izni ilə hər bir şeyi ki, Allah-Təala istəsə, göndərilən şəxsə vəhy edib yetirər.** (Necə ki, digər peyğəmbərlərə ehkam göndərmə yoludur). **Allahın Rəsulu (ə.s) çox vaxt deyirdi: “Müqəddəs Ruh filan hökmü mənim qəlbimə saldı.” (اِنَّهُ عَلِيٌّ حَكِيمٌ) Həqiqətən, Allah-Təala məxluq sifətlərinə sahib olmaqdan ucadır və hər bir feili hikmət üzrə ondan meydana gələr.**

**52) (وَكَذٰلِكَ اَوْحَيْنَآ اِلَيْكَ رُوحًا مِنْ اَمْرِنَا مَا كُنْتَ تَدْرِي مَا الْكِتَابُ وَلَا الْاِيمَانُ) -**(Ey Məhəmməd), **digər peyğəmbərlərə vəhy göndərən kimi sənə də öz əmrimizdən ruh** (Quran) **göndərdik.** (Bədən heyvani ruh səbəbi ilə dirilən kimi xalqın ölü qəlbi də Quran səbəbi ilə həyat tapıb haqqa qovuşarlar). **Sənə bu “Quran”ı elə bir halda göndərdik ki, Qurana və onun ehkamı ilə hidayət yoluna agah deyildin, Allah-Təala mərhəmət edib həm Quranı və həm də hidayət etmə yolunu sənə təlim etdi, həmin ruh** (Quran) **səbəbi ilə həm sənə, həm də iman edənlərə həmişəlik həyat verdi.**

**(وَلٰكِنْ جَعَلْنَاهُ نُورًا نَهْدِي بِهِ مَنْ نَشَآءُ مِنْ عِبَادِنَا) - Lakin bu Quranı elə bir nur etdik ki, onun səbəbinə sənin vasitənlə** (ey Məhəmməd), **bəndələrimizdən hər bir şəxsi ki, istəsək,** (hidayətə qabil olanları) **haqq tərəfinə hidayət edərik.**

**(وَاِنَّكَ لَتَهْدِيَ اِلٰى صِرَاطٍ مُسْتَقِيمٍ) - Və həqiqətən,** (ey Məhəmməd), **sən bu Quran səbəbi ilə xalqı düz yola** (islama) **hidayət edirsən.**

صِرَاطِ اللّٰهِ الَّذٖي لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۜ اَلَا اِلَى اللّٰهِ تَصٖيرُ الْاُمُورُ﴿٥٣﴾

**53) (صِرَاطِ اللّٰهِ الَّذٖي لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۜ) - O düz yol** (islam) **Allah-Təalanın elə bir yoludur ki, göylərdə və yerdə hər bir şeyin ixtiyarı ona məxsusdur. Necə istəsə, onları elə idarə edər, mane olan olmaz.**

**(اَلَا اِلَى اللّٰهِ تَصٖيرُ الْاُمُورُ) -** (Ey Məhəmməd), **xəbərdar ol ki, hər bir işin qayıdacağı yer Allah-Təalanın tərəfinədir. Qiyamət günündə yaxşı işə yaxşı, pisə pis cəza verəcəkdir.**

(Allaha həmd olsun, Şura surəsinin təfsiri bitdi. Nə gözəl vəzlər və ibrətverici kəlamlar, incəliklər bu mübarək surədə mövcuddur. Heyif ki, təfəkkür edib dərk edən azdır və bu səbəbdən Qurani-Şərifin incəlik və rəmzləri örtülü qalıb, islam ümməti içində ixtilaf peyda olubdur. Allah-Təala (52-ci ayədə) Qurani-Şərifi ruh adlandırdı. Belə ki, ölü qəlblərə onun müqəddəs ehkamı oxunub, həyat tapıb, insanlıq dairəsinə daxil olsunlar. Amma islam ümmətini elə bir qəflət tutubdur ki, belə əziz kəlamı ölülərə oxumağa məxsus edib, nadan və cahil şəxslərin oxumağı ilə meyitin cənnətə daxil olmağına ümid edib, hətta buna qəti olaraq inanırlar. Lakin öz ölü qəlblərini unudublar. Bundan da artıq cəhalət və Qurani-Şərifə (həqiqi ruha) haqsızlıq etmək olarmı? Allahın Rəsulu (ə.s) buyurubdur: “Kim ki, Şura surəsini oxusa, (yəni onda təfəkkür etsə) mələikənin salavat göndərib, Allahdan əfv istədiyi şəxslərdən olar”).

## əz-ZUXRUF SURƏSİ

43-cü surədir. Məkkədə nazil olub, 86 ayə, 833 kəlmə və 3400 hərfdir.

حٰمٓ ۚ﴿١﴾ وَالْكِتَابِ الْمُبِينِ ۙ﴿٢﴾ اِنَّا جَعَلْنَاهُ قُرْءٰنًا عَرَبِيًّا لَعَلَّكُمْ تَعْقِلُونَ ۚ﴿٣﴾ وَاِنَّهُ فٖٓي اُمِّ الْكِتَابِ
لَدَيْنَا لَعَلِيٌّ حَكٖيمٌ ۜ﴿٤﴾ اَفَنَضْرِبُ عَنْكُمُ الذِّكْرَ صَفْحًا اَنْ كُنْتُمْ قَوْمًا مُسْرِفٖينَ ﴿٥﴾ وَكَمْ اَرْسَلْنَا
مِنْ نَبِيٍّ فِي الْاَوَّلٖينَ﴿٦﴾ وَمَا يَأْتٖيهِمْ مِنْ نَبِيٍّ اِلَّا كَانُوا بِهٖ يَسْتَهْزِؤُنَ﴿٧﴾ فَاَهْلَكْنَٓا اَشَدَّ مِنْهُمْ بَطْشًا
وَمَضٰى مَثَلُ الْاَوَّلٖينَ ﴿٨﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (حٰمٓ) - Bu surənin adıdır.**

**2) (وَالْكِتَابِ الْمُبِينِ) -** (Ey Məhəmməd), **and olsun bu Qurana ki, hidayət yollarını zəlalətdən ayırıb fərqləndirəndir.**

**3) (اِنَّا جَعَلْنَاهُ قُرْءٰنًا عَرَبِيًّا لَعَلَّكُمْ تَعْقِلُونَ) -** (Ey Məhəmməd), **sən və sənin xalqın ərəb olduğu üçün, həqiqətən də, biz bu Quranı ərəb dilində etdik ki, onun uca məzmununu və böyük mənasını dərk edib anlayasınız.**

**4) (وَاِنَّهُ فٖٓي اُمِّ الْكِتَابِ لَدَيْنَا لَعَلِيٌّ حَكٖيمٌ) - Həqiqətən, bu Quran bizim yanımızda lövhü-məhfuzda (bizim elmimizdə) sabit və bərqərardır. Bizim tərəfimizdən nazil olan kitablar arasında möcüzəli, şanı uca olan, elm və hikməti ehtiva edən bir kitabdır.**

**5) (اَفَنَضْرِبُ عَنْكُمُ الذِّكْرَ صَفْحًا اَنْ كُنْتُمْ قَوْمًا مُسْرِفٖينَ) -** (Ey müşriklər, əgər siz cəhalətdə ifrat edib, zəlalətdə həddi aşsanız, necə ki həqiqətən də betsiniz), **cəhalətdə ifrat etməyinizə görə Quranı sizdən alıb, daha sizə Quranı nazil etməyək? Yox, sizin zəlalət və cəhalətdə ifrat etməyiniz Quranı nazil edib, sizə qadağaları bildirməyə bizə mane olmaz.**

**6) (وَكَمْ اَرْسَلْنَا مِنْ نَبِيٍّ فِي الْاَوَّلٖينَ) - Əvvəlki ümmətlər də sizin kimi cəhalət və zəlalətdə ifrat etdilər. Bununla belə nə qədər peyğəmbərlər onlara göndərib, cəhalət və zəlalətdə tüğyan etmələrinə baxmayıb, onları dəvət etmişik. Ta ki, onlara olan dəlilimiz tamamlansın.**

**7) (وَمَا يَأْتٖيهِمْ مِنْ نَبِيٍّ اِلَّا كَانُوا بِهٖ يَسْتَهْزِؤُنَ) - Əvvəlki ümmətlərə bizim tərəfimizdən elə bir peyğəmbər gəlmədi ki, ona istehza etməyib iman etsinlər.** (Necə ki, siz Qüreyş müşrikləri bu Məhəmmədə istehza edirsiniz).

**8) (فَاَهْلَكْنَٓا اَشَدَّ مِنْهُمْ بَطْشًا وَمَضٰى مَثَلُ الْاَوَّلٖينَ) -** (Ey Məhəmməd), **sənin xalqın-**

وَلَئِنْ سَأَلْتَهُمْ مَنْ خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ لَيَقُولُنَّ خَلَقَهُنَّ الْعَزِيزُ الْعَلِيمُۙ ﴿٩﴾ اَلَّذٖي جَعَلَ لَكُمُ الْاَرْضَ مَهْدًا وَجَعَلَ لَكُمْ فٖيهَا سُبُلًا لَعَلَّكُمْ تَهْتَدُونَۚ ﴿١٠﴾ وَالَّذٖي نَزَّلَ مِنَ السَّمَٓاءِ مَٓاءً بِقَدَرٍۚ فَاَنْشَرْنَا بِهٖ بَلْدَةً مَيْتًاۚ كَذٰلِكَ تُخْرَجُونَ ﴿١١﴾ وَالَّذٖي خَلَقَ الْاَزْوَاجَ كُلَّهَا وَجَعَلَ لَكُمْ مِنَ الْفُلْكِ وَالْاَنْعَامِ مَا تَرْكَبُونَۙ ﴿١٢﴾ لِتَسْتَوُ۫ا عَلٰى ظُهُورِهٖ ثُمَّ تَذْكُرُوا نِعْمَةَ رَبِّكُمْ اِذَا اسْتَوَيْتُمْ عَلَيْهِ وَتَقُولُوا سُبْحَانَ الَّذٖي سَخَّرَ لَنَا هٰذَا وَمَا كُنَّا لَهُ مُقْرِنٖينَۙ ﴿١٣﴾

---

**dan olan müşriklərdən daha güclü və qüvvətli olan əvvəlki ümmətləri də həlak etmişik. Onların təəccüblü qissələri həmin Quranda bir neçə məqamda bəhs olunubdur. Onlar bizi aciz etmədilər. Bunları həlak etməyə də əlbəttə qadirik.**

**9) (وَلَئِنْ سَأَلْتَهُمْ مَنْ خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ لَيَقُولُنَّ خَلَقَهُنَّ الْعَزِيزُ الْعَلِيمُ) -** (Ey Məhəmməd), **əgər müşriklərdən soruşsan ki, bəs göyləri və yeri kim yaradıbdır? Əlbəttə, sənin cavabında deyəcəklər: "Məxluqata qalib və hər bir şeyə agah olan Allah-Təala onları yaradıbdır. Bunu inkar etməyəcəklər.**

**10) (اَلَّذٖي جَعَلَ لَكُمُ الْاَرْضَ مَهْدًا وَجَعَلَ لَكُمْ فٖيهَا سُبُلًا لَعَلَّكُمْ تَهْتَدُونَ) - Allah-Təalanın sifətlərindən biri də budur ki, sizdən ötrü həmin bu yeri** (uşaq behiştdə rahat olan kimi) **beşik kimi rahat etdi və sizdən ötrü yerdə yollar yaratdı. Belə ki, o yolların səbəbinə səfərlərinizdə məqsədinizə tərəf doğru gedəsiniz.**

**11) (وَالَّذٖي نَزَّلَ مِنَ السَّمَٓاءِ مَٓاءً بِقَدَرٍۚ) - Allah-Təalanın sifətlərindən biri də budur ki, hər bir yerin ehtiyacı və bəndələrin məişətlərini islah edən qədər göydən su göndərdi. (فَاَنْشَرْنَا بِهٖ بَلْدَةً مَيْتًاۚ كَذٰلِكَ تُخْرَجُونَ) -** (Ey Məhəmməd), **o suyun səbəbinə hər bir ölü yeri dirildib, hər bir növ gül və çiçəkdən xali olandan sonra döndərib, gözəl və təzə yaşıllıq surətinə daxil etdik. Ölü yerə həyat verən kimi siz insanları da yerdən çıxarıb, yenidən həyat verib məhşərdə dirildərik. Bu iki növ həyat verməkdə bizim qüdrətimiz eynidir. Heç bir fərq yoxdur.**

**12) (وَالَّذٖي خَلَقَ الْاَزْوَاجَ كُلَّهَا) - Allah-Təalanın sifətlərindən biri də budur ki, hər bir sinif məxluqu yaradıb, yoxdan meydana gətirdi.**

**(وَجَعَلَ لَكُمْ مِنَ الْفُلْكِ وَالْاَنْعَامِ مَا تَرْكَبُونَ) - Sizdən ötrü gəmiləri və 4 ayaqlı heyvanları minib, səfərlərə getməyi təyin etdi.**

**13) (لِتَسْتَوُ۫ا عَلٰى ظُهُورِهٖ ثُمَّ تَذْكُرُوا نِعْمَةَ رَبِّكُمْ اِذَا اسْتَوَيْتُمْ عَلَيْهِ) - Belə ki, gəmilərə və heyvanların üstünə minib rahat olasınız. Ondan sonra elə ki, rahat oldunuz, rəbbiniz Allah-Təalanın nemətini qəlbinizdə yad edəsəniz ki, belə miniyi sizdən ötrü yaradıbdır.** (Gəmi hərçənd insan sənəti ilə icad olunub, lakin onu icad edən əsl ağıl gücü Allah-Təaladan olduğuna görə gəminin icadını özünə isnad etdi). **(وَتَقُولُوا سُبْحَانَ الَّذٖي سَخَّرَ لَنَا هٰذَا وَمَا كُنَّا لَهُ مُقْرِنٖينَ) - Qəlbinizdə**

وَاِنَّٓا اِلٰى رَبِّنَا لَمُنْقَلِبُونَ ﴿١٤﴾ وَجَعَلُوا لَهُ مِنْ عِبَادِهِ جُزْءًاۜ اِنَّ الْاِنْسَانَ لَكَفُورٌ مُبِينٌۜ ﴿١٥﴾

---

**Allah-Təalanın nemətini yad edəndən sonra dil ilə Allah-Təalaya* həmdsəna edib deyəsiniz: "Hər bir eyib və nöqsandan pak və ucadır, o Allah-Təala ki, bunları bizə tabe edib, öz istəyimizlə onları hər bir tərəfə aparmağa bizi sahib edibdir və halbuki bizim onları ram və xidmət etdirməyə qüdrətimiz yox idi."**

(***Qeyd:** *uca peyğəmbərimiz (ə.s) elə ki, mübarək ayaqlarını üzəngiyə qoyardı, - bismillah deyərdi. Elə ki minib oturdu əlhəmdülillah deyib, ondan sonra həmin ayəni oxuyub, 3 dəfə Allahu-əkbər, 3 dəfə də la ilahə illəllah deyərdi. Həzrət Nuh isə gəmiyə minərkən "Gəminin üzüb getməsi də, durması da Allahın adı ilədir. Şübhəsiz ki, rəbbim çox əfv edəndir" ayəsini oxuyardı. Bu kimi hərəkətlər Allah-Təalanın hörmətini gözəl şəkildə qoruyub, onu hər bir məqamda düşünməyə açıq dəlildir. Allah-Təala bizi də o cənaba tabe edib, onun yolu ilə gedənlərdən etsin. Amin! İnsanların hər bir sənətin gözəlliyinə diqqətlə baxıb təfəkkür etməsi gözəldir, lakin bizim bu zəmanədə islamın adından başqa bir şey qalmayıbdır. Uca peyğəmbərimizin hikmət qaynağı olan sözləri və davranışları islam ümməti tərəfindən unudulub, adlarnı millət və məzhəb rəisi qoyan zəlil və rəzil şəxslər islamda bidətlər yaradıb, hər biri ayrı bir yol seçibdir. Qurani-Şərifin ehkamı və uca peyğəmbərin ədəbindən başqa nə bidət və zəlalət istəsən, islam ümmətinin arasında rəvac tapıb, din və məzhəb kimi olubdur. İslam ümmətinin arasında olmayan şey Quran sözüdür, bu kitaba baxan şəxslərin əksəriyyəti o sözdən hürküb, çəkinəcəklər, lakin mən həqir və günahkar onlardan xahiş edirəm ki, insaf üzrə baxıb fikir versinlər. Görəsən, islam ümmətinin arasındakı bu ixtilaf haradan yarandı? Bəs bu ixtilafla demək olar ki, biz Qurani-Şərifə və uca peyğəmbərin ədəbinə tabe olub, islam dini üzrə doğru yoldayıq? Hansı ki, bizim aramızda müftülərin Qurana zidd olaraq şəriət hökmü adlanan fitvalarını özümüzə ilahi hökm və nicat səbəbi sayıb, onun xilafına danışanlara küfr və zındıqlıq isnad edirik. Bununla belə özümüzə Quran əhli deyib, qurtulmuş hesab edirik. Bəs bu ixtilaflarla ar etməyib, özümüzə Quran əhli adını veririk. Ar olsun bizə. Zəmanəyə baxıb, öz halətimizdən yazmaqdan bezib, qələm itaətdən çıxdı. Allahım, bizə bir qurtuluş və çıxış qapısı lütf et!*)

**14) (وَاِنَّٓا اِلٰى رَبِّنَا لَمُنْقَلِبُونَ) - Əgər hər bir halda ölüm bizə gəlsə, həqiqətən, biz rəbbimiz Allah-Təalanın tərəfinə qayıdıb məhşərə hazır olacağıq.**

**15) (وَجَعَلُوا لَهُ مِنْ عِبَادِهِ جُزْءًاۜ اِنَّ الْاِنْسَانَ لَكَفُورٌ مُبِينٌۜ)** - (Ey Məhəmməd), **müşriklərdən soruşanda ki, göyləri və yeri kim yaradıbdır? İqrar edib deyərlər: "Allah-Təala yaradıb və halbuki bu iqrarla birlikdə Allah-Təalaya şərik qoşub, özünün yaratdığı bəndələrini onun bir parçası sayıb, bəziləri Üzeyri, bəziləri Məsihi Allah-Təalanın oğlu və bəziləri də mələikəni Allah-**

اَمِ اتَّخَذَ مِمَّا يَخْلُقُ بَنَاتٍ وَاَصْفٰيكُمْ بِالْبَنِينَ ﴿١٦﴾ وَاِذَا بُشِّرَ اَحَدُهُمْ بِمَا ضَرَبَ لِلرَّحْمٰنِ مَثَلًا
ظَلَّ وَجْهُهُ مُسْوَدًّا وَهُوَ كَظِيمٌ﴿١٧﴾ اَوَمَنْ يُنَشَّؤُا فِي الْحِلْيَةِ وَهُوَ فِي الْخِصَامِ غَيْرُ مُبِينٍ ﴿١٨﴾

---

**Təalanın qızı sayıblar. Necə ki, övlad atadan bir parçadır, bunları da Allah-Təalaya övlad saymaqla, ona cüzilik isnad edirlər.** (Ey Məhəmməd), **həqiqətən, insan açıq-aşkar nankorluq edib, nemət qədrini bilməyəndir.**

**16) (اَمِ اتَّخَذَ مِمَّا يَخْلُقُ بَنَاتٍ وَاَصْفٰيكُمْ بِالْبَنِينَ) - Əgər bir ehtimal, Allah-Təala özündən ötrü övlad seçmək istəsə, bəs öz yaratdığı məxluqdan qızları götürüb, oğlanları sizə veribdir? Nə pis bölgü edirsiniz. Öz istədiyinizi Allah-Təalaya isnad edirsiniz, sizin qızınız olanda, onu yerə basdırıb, oğlanı mühafizə edirsiniz. Bu yanlış işdir. Əgər Allah-Təala övlad istəsə, oğlanı özü götürüb, qızı sizə verər və halbuki oğlan, qız hamısı Allah-Təalanın məxluqudur.** (Ərəb qəbilə başçıları qızları olanda yerə basdırıb, oğlanı saxlayardılar, bu mətləbin təfsilatı bu kitabın I cildində, Ənam surəsinin 140-cı ayəsinin təfsirində bəyan olundu. Oraya baxılsın).

**17) (وَاِذَا بُشِّرَ اَحَدُهُمْ بِمَا ضَرَبَ لِلرَّحْمٰنِ مَثَلًا ظَلَّ وَجْهُهُ مُسْوَدًّا وَهُوَ كَظِيمٌ) -** (Ey Məhəmməd), **bu müşriklərin halına bax, o zaman ki, onlardan birinə Allah-Təalanın həmcinsi saydıqları qız övladı müjdəsi verildi, qəm-qüssədən, qeyzdən üzü qaralar, müşriklərin qızı olanda bu hala düşərlər, amma həmin qızı Allah-Təalaya isnad edərlər.**

**18) (اَوَمَنْ يُنَشَّؤُا فِي الْحِلْيَةِ وَهُوَ فِي الْخِصَامِ غَيْرُ مُبِينٍ) -Bəs o məxluq (qız) ki,* zinət və rahatlıqla tərbiyə edilsin və kişilər kimi savaş məqamında məqsədini isbat etməyə qadir olmasın, müşriklərin nəzərlərində əskik olan belə məxluq Allah-Təalaya övlad sayılarmı?**

**(*Qeyd:** *"Allah-Təala ayədə zinətlənib rahatlanmağı qadınlara isnad edir. Yəni zinət və rahatlıq qadınlara məxsusdur. Kişilər gərək zinətlərdən üz döndərib, qadınlara məxsus olan zinətləri və libasları geyinməyi, onlar kimi rahatlanmağı tərk edib, özlərini zəhmətə vadar etsinlər. Necə ki, Ömər ibn Xəttab xütbəsində dedi: "Ey insanlar, libasınızı qaba edib, quru yerlərdə yatıb, özünüzü kişilərdən sayıb, hünər göstərib, şərəfli, böyük işlərə təşəbbüs edin. Kişi gərək qadın zinətini tərk edib kişi kimi olsun. Əgər zinət istəsələr, gərək batində nəfsini təqva libası ilə bəzəyib, böyük cihad edib, din düşmənlərini dəf etməyə səy etsinlər. Amma bizim bu zamanda cəhalət yayıldığı üçün kişilər qadınlara məxsus olan qızıl və ipək libaslarla bəzənib, hətta bəziləri əxlaqsız qadın surətinə girirlər. Din ehkamından heç bir şey dərk etməyib, zəlalət vadisində çaşqın və sərgərdan dolanırlar).*

وَجَعَلُوا الْمَلٰئِكَةَ الَّذٖينَ هُمْ عِبَادُ الرَّحْمٰنِ اِنَاثًاۜ اَشَهِدُوا خَلْقَهُمْۜ سَتُكْتَبُ شَهَادَتُهُمْ وَيُسْئَلُونَ ﴿١٩﴾
وَقَالُوا لَوْ شَٓاءَ الرَّحْمٰنُ مَا عَبَدْنَاهُمْۜ مَا لَهُمْ بِذٰلِكَ مِنْ عِلْمٍۗ اِنْ هُمْ اِلَّا يَخْرُصُونَۜ ﴿٢٠﴾ اَمْ اٰتَيْنَاهُمْ
كِتَابًا مِنْ قَبْلِهٖ فَهُمْ بِهٖ مُسْتَمْسِكُونَ ﴿٢١﴾ بَلْ قَالُٓوا اِنَّا وَجَدْنَٓا اٰبَٓاءَنَا عَلٰٓى اُمَّةٍ وَاِنَّا عَلٰٓى اٰثَارِهِمْ
مُهْتَدُونَ﴿٢٢﴾

---

**19) (وَجَعَلُوا الْمَلٰئِكَةَ الَّذٖينَ هُمْ عِبَادُ الرَّحْمٰنِ اِنَاثًاۜ اَشَهِدُوا خَلْقَهُمْ)** - (Ey Məhəmməd), **müşriklər Allah-Təalanın əziz, hörmətli bəndələrini (məlaikəni)* dişi sayırlar, bəs bu müşriklər onlar yaradılan zaman orada hazır idilər ki, onların erkək, ya da dişi olmalarından agah olsunlar?** (Allahın Rəsulu (ə.s) müşriklərdən soruşdu: “Haradan bilirsiniz ki, mələklər qızdır? Dedilər: “Ata-babalarımızdan eşitmişik və şəhadət edirik ki, ata-babalarımız yalançı deyildir. O vaxt bu ayənin son qismi nazil olub, onlara cavab verildi).

**(سَتُكْتَبُ شَهَادَتُهُمْ وَيُسْئَلُونَ)** - (Ey Məhəmməd), **onların bu şəhadətləri yazılıb,** (bizim elmimizdə qeyd olunub), **qiyamət günündə həmin şəhadət barəsində sorğu-sual olunacaqlar.**

**(*Qeyd:** *“Müşriklər onlara qız deyirlər, lakin bizim millətin nadan yazıçıları onları quş kimi fərz edib onların tüklərindən mütəkkə düzəldib imam Hüseynin başının altına qoyurlar. Ah, bu nə cəhalətdir. Bəli, ilahi kəlamın həqiqətinə agah olmayanda belə xurafat və mövhumat meydana çıxır. Bəzi rəvayətlərdə mələklərin (mücərrəd cövhərin) sürətli hərəkətini avamlara izah etmək üçün onlara qanad çalma rəmzi nisbət edildiyindən cahillər onları quş kimi tüklü bir şey fərz ediblər. Nə böyük cəhalət!)*

**20) (وَقَالُوا لَوْ شَٓاءَ الرَّحْمٰنُ مَا عَبَدْنَاهُمْ)** - (Ey Məhəmməd), **müşriklər Allah-Təalaya şirk qoşub, bununla belə deyirlər: “Əgər Allah-Təala istəsə idi, biz bütlərə sitayiş etməz idik. Bütlərə ibadət etməmizə zorla mane olardı. (مَا لَهُمْ بِذٰلِكَ مِنْ عِلْمٍۗ اِنْ هُمْ اِلَّا يَخْرُصُونَ) - Müşriklərin bu sözlərinin həqiqətinə elmi olmayıb yalan və iftira deyirlər, çünki Allahu Təala insanı dünyada hər feildə azad yaradıbdır. Müşriklər öz əməllərini Allah-Təalaya isnad edirlər. Müşrik və ya müvəhhid olmaq öz ixtiyarlarındadır. Onlar şirki tövhidə üstün sayıblar. O səbəbdən Allah-Təala onlara əzab edəcəkdir.**

**21) (اَمْ اٰتَيْنَاهُمْ كِتَابًا مِنْ قَبْلِهٖ فَهُمْ بِهٖ مُسْتَمْسِكُونَ) - Ya da ki, bəlkə biz müşriklərə bu Qurandan qabaq bir kitab verib, o kitabda onlara bütlərə sitayiş edib, müşrik olmağa əmr etmişik ki, o kitaba yapışıb, əməl edib, şirki tövhidə üstün sayıblar?**

**22) (بَلْ قَالُٓوا اِنَّا وَجَدْنَٓا اٰبَٓاءَنَا عَلٰٓى اُمَّةٍ وَاِنَّا عَلٰٓى اٰثَارِهِمْ مُهْتَدُونَ) - Biz müşriklərə elə bir kitab verməmişik ki, onların şirk barəsində dəlilləri olsun. Əksinə, heç bir dəlilləri olmayıb, təqlid içində idilər. Həqiqətən, biz ata-babala-**

وَكَذٰلِكَ مَٓا اَرْسَلْنَا مِنْ قَبْلِكَ فٖي قَرْيَةٍ مِنْ نَذٖيرٍ اِلَّا قَالَ مُتْرَفُوهَٓاۙ اِنَّا وَجَدْنَٓا اٰبَٓاءَنَا عَلٰٓى اُمَّةٍ وَاِنَّا عَلٰٓى
اٰثَارِهِمْ مُقْتَدُونَ ﴿٢٣﴾ قَالَ اَوَلَوْ جِئْتُكُمْ بِاَهْدٰى مِمَّا وَجَدْتُمْ عَلَيْهِ اٰبَٓاءَكُمْۜ قَالُوٓا اِنَّا بِمَٓا اُرْسِلْتُمْ بِهٖ
كَافِرُونَ ﴿٢٤﴾ فَانْتَقَمْنَا مِنْهُمْ فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الْمُكَذِّبٖينَ۟ ﴿٢٥﴾ وَاِذْ قَالَ اِبْرٰهٖيمُ لِاَبٖيهِ وَقَوْمِهٖٓ
اِنَّنٖي بَرَٓاءٌ مِمَّا تَعْبُدُونَۙ ﴿٢٦﴾ اِلَّا الَّذٖي فَطَرَنٖي فَاِنَّهُ سَيَهْدٖينِ ﴿٢٧﴾ وَجَعَلَهَا كَلِمَةً بَاقِيَةً فٖي عَقِبِهٖ
لَعَلَّهُمْ يَرْجِعُونَ ﴿٢٨﴾

---

**rımızı bir dində** (bütpərəstlik) **tapıb, onların dinlərini təqlidlə qəbul etdik və həqiqətən, onları təqlid edib, dinlərinə tabe olmaqla biz hidayət tapıb haqqa qovuşmuşuq.**

**23)** (وَكَذٰلِكَ مَٓا اَرْسَلْنَا مِنْ قَبْلِكَ فٖي قَرْيَةٍ مِنْ نَذٖيرٍ اِلَّا قَالَ مُتْرَفُوهَٓاۙ اِنَّا وَجَدْنَٓا اٰبَٓاءَنَا عَلٰٓى اُمَّةٍ وَاِنَّا عَلٰٓى اٰثَارِهِمْ مُقْتَدُونَ) **-** (Ey Məhəmməd), **səni peyğəmbər göndərən kimi, səndən qabaq elə bir peyğəmbər göndərmədik ki, o yerin zəngin əhli o peyğəmbərə itaət etməyib deməsinlər: "Həqiqətən, biz ata-babalarımızı bir dində (bütpərəstlikdə) tapıb, onların dininə tabe olub, təqlid etmişik.** (Necə ki, ey Məhəmməd, Qüreyş müşrikləri sənə dedilər: "Hər bir peyğəmbərə ümməti belə deyibdir, sən qəmgin və üzgün olma).

**24)** (قَالَ اَوَلَوْ جِئْتُكُمْ بِاَهْدٰى مِمَّا وَجَدْتُمْ عَلَيْهِ اٰبَٓاءَكُمْ) **Hər peyğəmbər öz xalqına dəvət məqamında deyibdir: "Əgər mən sizdən ötrü elə bir din gətirsəm ki, sizi ata-babalarınızın dinindən daha artıq hidayət edər, yenə də ata-babalarınızın dininə tabe olarsınız?** (قَالُوٓا اِنَّا بِمَٓا اُرْسِلْتُمْ بِهٖ كَافِرُونَ) **- Müşriklər cavab verib peyğəmbərlərə dedilər: "Həqiqətən, biz ata-babalarımızın dinində sabit və bərqərar olub, sizin dediyinizə - Allah-Təaladan göndərilən dinə kafir olduq."**

**25)** (فَانْتَقَمْنَا مِنْهُمْ فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الْمُكَذِّبٖينَ) **-** (Ey Məhəmməd), **biz də onlardan intiqam alıb, hamısını həlak etdik. Bax gör ki,** (Ey Məhəmməd), **bizim peyğəmbərlərimizi təkzib edənlərin axırı necə oldu, dünyada onları əzab tutub axirətdə də həmişə əzaba düçar olacaqlar.**

**26)** (وَاِذْ قَالَ اِبْرٰهٖيمُ لِاَبٖيهِ وَقَوْمِهٖٓ اِنَّنٖي بَرَٓاءٌ مِمَّا تَعْبُدُونَ) **-** (Ey Məhəmməd), **yadına sal, o zaman ki, İbrahim atasını və xalqını bizim tərəfimizə dəvət edib dedi: "Həqiqətən, mən sizin ibadət etdiyinizdən (bütlərdən) uzaq olub, heç vaxt onlara ibadət etmərəm.**

**27)** (اِلَّا الَّذٖي فَطَرَنٖي فَاِنَّهُ سَيَهْدٖينِ) **- Ancaq o Allah-Təala ki, məni yoxdan yaradıbdır, onu sevib, itaət edərəm. Həqiqətən, o məni hidayətdə sabit və bərqərar edir.**

**28)** (وَجَعَلَهَا كَلِمَةً بَاقِيَةً فٖي عَقِبِهٖ لَعَلَّهُمْ يَرْجِعُونَ) **-** (Cənab İbrahim) **tövhid kəlməsini özündən sonra övladının içində həmişəlik qoydu, ta ki, onlar müvəhhid**

بَلْ مَتَّعْتُ هٰؤُلَٓاءِ وَاٰبَٓاءَهُمْ حَتّٰى جَٓاءَهُمُ الْحَقُّ وَرَسُولٌ مُبِينٌ ﴿٢٩﴾ وَلَمَّا جَٓاءَهُمُ الْحَقُّ قَالُوا هٰذَا سِحْرٌ وَاِنَّا بِه۪ كَافِرُونَ ﴿٣٠﴾ وَقَالُوا لَوْلَا نُزِّلَ هٰذَا الْقُرْاٰنُ عَلٰى رَجُلٍ مِنَ الْقَرْيَتَيْنِ عَظ۪يمٍ ﴿٣١﴾

---

**olub xalqı tövhidə dəvət etsinlər ki, müşriklər də onların dəvətini qəbul edib, küfr və zəlalətdən qayıdıb müvəhhid olsunlar.**

**29)** (بَلْ مَتَّعْتُ هٰؤُلَٓاءِ وَاٰبَٓاءَهُمْ حَتّٰى جَٓاءَهُمُ الْحَقُّ وَرَسُولٌ مُبِينٌ) **- Lakin** (Ey Məhəmməd), **müşriklərə və ata-babalarına nemət verib ömürlərini uzun etdim. Ta ki, haqq** (Quran) **və peyğəmbərliyi zahir və aşkar olan peyğəmbər** (yəni sən, Ey Məhəmməd) **onlara peyğəmbər gəldi.**

**30)** (وَلَمَّا جَٓاءَهُمُ الْحَقُّ قَالُوا هٰذَا سِحْرٌ وَاِنَّا بِه۪ كَافِرُونَ) **- O zaman ki, haqq** (Quran) **müşriklərə gəlib, sən** (Ey Məhəmməd), **müşrikləri Qurana dəvət etdin, sənin dəvətinə müqabil küfr cavabı verib dedilər: "Bu Quran sehrdir və həqiqətən, biz ona tabe olub itaət etmərik.**

**31)** (وَقَالُوا لَوْلَا نُزِّلَ هٰذَا الْقُرْاٰنُ عَلٰى رَجُلٍ مِنَ الْقَرْيَتَيْنِ عَظ۪يمٍ) **- Amma sənin haqqında (Ey Məhəmməd), belə dedilər*. Birincisi – insandan peyğəmbər olmaz. Əgər olsa, gərək var-dövlət sahibi şəxslərdən olsun. Əgər bu Quran Allah-Təaladandırsa, nədən ötrü Məkkə və Taifdən bir böyük kişiyə, Məkkədə** (Vəlid ibn Müğirəyə), **Taifdə** (Urvə ibn Məsuda) **nazil olmur? Əgər insandan peyğəmbər olsa, bu iki varlı kişidən birinə gərək kitab nazil olub, peyğəmbər olsunlar.**

**(*Qeyd:** *"Məkkə əhli olan Qüreyş camaatı inad edib, əvvəlcə insanın peyğəmbər olmasını inkar etdilər. Elə ki, hər bir növ dəlil onlara göstərilib, peyğəmbərlərin insandan olması onlara aydın olub aciz qaldılar, ondan sonra başqa səbəblərlə inkar edib dedilər: "İndi ki, insandan peyğəmbər olur, gərək var-dövlət sahiblərindən olsun. Məkkədə ən varlı şəxs Vəlid ibn Müğirə, Taifdə Urvə ibn Məsud idi. Gərək bunlardan biri peyğəmbər olsun. Sən ki, Məhəmməd Abdullah oğlusan, doğrudur, soyun ucadır, lakin var-dövlət sahibi deyilsən və bu səbəbdən peyğəmbər olmaq sənə layiq deyildir. Axmaqlar elmin uca mərtəbəsini dərk etməyib, özləri cahil olub, dünyada var-dövlətdən başqa bir şey görməyib, kamil insana məxsus olan peyğəmbərliyi də varlı şəxsə məxsus sayırlar. Bu sözləri müşriklər məhz cəhalət və nadanlıqdan deyib, batil sözlərini və etiqadlarını yayıb, haqqı dəf və batil etmək üçün səy edirdilər. Hər bir haqq sözün müqabilində baxıb görürsən ki, özlərini alim sayan cahillər də belə axmaq sözləri dəlil gətirib, haqqı dəf edib, Allah-Təalanın nurunu söndürməyə çalışırlar. "Amma kafirlər istəməsə də Allah nurunu tamamlayacaq", necə ki, bizim dövrümüzdə cahillərə Qurani-Şərifin ehkamını bildirəndə, onun müqabilində hiylə edib, əsassız yozumlar irəli sürürlər. "Xəbəri-vahid"lə (bir nəfərdən gələn hədislə) Qurani-Şərifi hökmsüz edib, hökmünü məhdudlaşdırıb, onun tabe olunması vacib olan ehkamını tərk*

اَهُمْ يَقْسِمُونَ رَحْمَتَ رَبِّكَ ۜ نَحْنُ قَسَمْنَا بَيْنَهُمْ مَعِيشَتَهُمْ فِي الْحَيٰوةِ الدُّنْيَا وَرَفَعْنَا بَعْضَهُمْ فَوْقَ
بَعْضٍ دَرَجَاتٍ لِيَتَّخِذَ بَعْضُهُمْ بَعْضًا سُخْرِيًّا ۗ وَرَحْمَتُ رَبِّكَ خَيْرٌ مِمَّا يَجْمَعُونَ﴿٣٢﴾ وَلَوْلَآ اَنْ
يَكُونَ النَّاسُ اُمَّةً وَاحِدَةً

---

*edirlər. Uca Peyğəmbərimiz (ə.s) Qurani-Şərifi xalqa oxuyanda, bəs onun ehkamını məhdudlaşdırıb, xalqa demişdi ki, bu ayənin mənası elə deyil, belədir, məqsəd filan mənadır ki, ayənin hökmünü məhdudlaşdırsınlar? Nisa surəsində bir xanım ilə kifayət edib, çoxevlilik xüsusunda nəinki ədaləti tərk etməməyi, hətta ədalətsizlikdən qorxmağı şərt qoşandan sonra hansı xəbərlə ayənin uca məzmunu tərk olunub, çoxevlilik qeydsiz-şərtsiz islam ümməti arasında rəvac tapıb, ədalət təmin edilmir? Bir halda ki, Qurani-Şərif və adil peyğəmbərimiz qadınları qorumağı əmr edir, niyə ondan sonra da hər bir zülm onlara rəva görülüb, böyük şər və fəsadlar meydana gəlir? O, hansı xəbərdir ki, miras ehkamını bildirən ayənin ümumi mənasını məhdudlaşdırıb, ögey övladın miras almasına mane olur? Belə fəsad iş olarmı ki, bir ayənin hökmü doğma övlad barəsində bir cür, ögey övlad haqqında başqa cür olsun, bundan da artıq Qurani-Şərifin ayələrini təhrif etmək olarmı? Allah etdiklərinizi görəndir).*

**32) (اَهُمْ يَقْسِمُونَ رَحْمَتَ رَبِّكَ)** - (Ey Məhəmməd), **bəs müşriklər sənin rəbbin Allah-Təalanın rəhmətini** (peyğəmbərliyi) **istədikləri kəslərə paylaşdırırlar? Bu, Allah-Təalaya məxsusdur. Allah-Təala öz kamil qüdrəti ilə bunu paylaşdırıb, öz kamil hikməti ilə peyğəmbərliyə layiq şəxsi seçər.**

**(نَحْنُ قَسَمْنَا بَيْنَهُمْ مَعِيشَتَهُمْ فِي الْحَيٰوةِ الدُّنْيَا) - Onlar peyğəmbərliyi necə paylaşdıra bilərlər? Halbuki öz işlərini islah edib, ruzilərini paylaşdırmağa qadir deyildirlər. Biz onların arasında dünya həyatında ruzilərini bölüb, hər bir şəxsdən ötrü bir ruzi müəyyən etmişik.**

**(وَرَفَعْنَا بَعْضَهُمْ فَوْقَ بَعْضٍ دَرَجَاتٍ لِيَتَّخِذَ بَعْضُهُمْ بَعْضًا سُخْرِيًّا) - Hikmət üzrə onların bəzisini digərlərindən uca dərəcələrlə üstün etmişik.** (Bəzisini güclü və varlı, bəzisini zəif və kasıb etmişik). **Belə ki, bir-birlərini lazım olan xidmətdən ötrü istifadə edib, ehtiyaclarını həll etmək üçün işlətsinlər. Əgər hamısına bərabər** (zənginlik və ya kasıblıq) **versəydik, aləm xarab, dünya fəsad içində olardı və əgər onların işlərinin islahını və ruzilərini özlərinə həvalə etsəydik, hər halda işləri zay və pozulmuş, özləri həlak olardılar. Öz işlərinin islah və tədbirində aciz olarkən, peyğəmbərlik işini islah edib, paylaşdırmağa necə qadir olarlar? (وَرَحْمَتُ رَبِّكَ خَيْرٌ مِمَّا يَجْمَعُونَ)** - (Ey Məhəmməd), **sənin rəbbin Allah-Təalanın rəhməti və dini** (şirki tərk edib müvəhhid olmaq) **onların cəm etdiyi dünya malından yaxşıdır.**

**33) (وَلَوْلَآ اَنْ يَكُونَ النَّاسُ اُمَّةً وَاحِدَةً)** -(Ey Məhəmməd), **əgər insanlar kafir və müşriklərin dünya nemətini firavan və bolluq içində görəndə, hamısı bir-**

لَجَعَلْنَا لِمَنْ يَكْفُرُ بِالرَّحْمٰنِ لِبُيُوتِهِمْ سُقُفًا مِنْ فِضَّةٍ وَمَعَارِجَ عَلَيْهَا يَظْهَرُونَ ﴿٣٣﴾ وَلِبُيُوتِهِمْ اَبْوَابًا
وَسُرُرًا عَلَيْهَا يَتَّكِؤُ نَ ﴿٣٤﴾ وَزُخْرُفًا وَاِنْ كُلُّ ذٰلِكَ لَمَّا مَتَاعُ الْحَيٰوةِ الدُّنْيَا وَالْاٰخِرَةُ عِنْدَ رَبِّكَ
لِلْمُتَّقِينَ ﴿٣٥﴾ وَمَنْ يَعْشُ عَنْ ذِكْرِ الرَّحْمٰنِ نُقَيِّضْ لَهُ شَيْطَانًا فَهُوَ لَهُ قَرِينٌ ﴿٣٦﴾

---

**ləşib, kafir olmasaydılar, (لَجَعَلْنَا لِمَنْ يَكْفُرُ بِالرَّحْمٰنِ لِبُيُوتِهِمْ سُقُفًا مِنْ فِضَّةٍ وَمَعَارِجَ عَلَيْهَا يَظْهَرُونَ) hər halda Rəhman olan Allah-Təalaya kafir olanların hamısının evlərindən ötrü* gümüşdən tavanlar və pillələr verərdik. O pillələrlə evlərinə çıxardılar.**

**(*Qeyd:** *"Bu ayələrdən anlaşılan məna budur ki, Allah-Təala islamın zühurundan əvvəl Ərəbistanda olan kafirlərin məişətlərini dar edib, onlara o qədər çox bolluq verməyibdir. Belə ki, xalq onların bol dünya nemətini düşünüb, onlara meyl edib küfrlərində sabit qalmasınlar və həqiqətən də, belədir, lakin bu zamanda Allah-Təalanın dünyanın hər bir yerinə zinət verdiyi görünür. Qızılı, gümüşü kafir müşriklərə verməsindən məlum olur ki, xalq islam dinini tərk edib, hamısı küfrdə birləşməyəcəklər və bu səbəbdən islam ümmətinə verdiyindən çox kafirlərə verir və həqiqətən də, belədir. Ayələr böyük hikmətləri ehtiva edir. Necə ki, bu zəmanədə görünür, kafirlərə səylərinə görə islam ümmətinin müqabilində daha çox dünya neməti bəxş edibdir. İslam ümmətinin cəhaləti və tənbəlliyi belə islamın özünə heç bir nöqsan yetirməyib. Islam ümmətinin sayı daha da çox artıb, islam dini yer kürəsinin hər bir tərəfinə yayılmaqdadır. Ancaq daxili nifaq islamı böyük rəzalətlərə düçar edibdir. Allahın qulları haqda olan hikməti nə ucadır!)*

**34) (وَلِبُيُوتِهِمْ اَبْوَابًا وَسُرُرًا عَلَيْهَا يَتَّكِؤُ نَ) - Və onların evlərindən ötrü gümüşdən qapılar və taxtlar verdik və taxtlara söykənib, rahat olardılar.**

**35) (وَزُخْرُفًا) - Və bu bəhs olunan şeylərə əlavə olaraq Allah-Təala onlardan ötrü qızıldan da zinət verirdi. Dünya Allah-Təalanın yanında həqir bir şey olduğu üçün hər bir gözəl şeyi Allah-Təala kafirlərə verirdi. Lakin xalq o şeyləri kafirlərdə görəndə, hamısı dönüb kafir olduğu üçün, kafirlərə o bolluğu verməyib hamısını bu şəkildə varlı etmədi. Əksinə, bəzisini varlı, bəzisini kasıb etdi.**

**(وَاِنْ كُلُّ ذٰلِكَ لَمَّا مَتَاعُ الْحَيٰوةِ الدُّنْيَا وَالْاٰخِرَةُ عِنْدَ رَبِّكَ لِلْمُتَّقِينَ) - Bu bəhs olunan şeylər** (zinətlər) **hamısı dünya həyatının müvəqqəti mənfəətləridir. Yox olacaqlar. Zəngin və kasıb hamısını ölüm ziyarət edəcəkdir.** (Ey Məhəmməd), **sənin rəbbin Allah-Təalanın yanında möminlərdən ötrü axirətin əcr və savabı hazırdır.**

**36) (وَمَنْ يَعْشُ عَنْ ذِكْرِ الرَّحْمٰنِ نُقَيِّضْ لَهُ شَيْطَانًا فَهُوَ لَهُ قَرِينٌ)** - (Ey Məhəmməd), **kim kor olub Rəhman olan Allah-Təalanın zikrindən üz döndərər, ondan ötrü bir şeytan** (şəri əmr edən xəbis nəfs) **seçib, onun xəbis əməllərinə görə ona düçar edərik ki, həmişə ona sahib olub, heç bir xeyir əməl ondan meyda-**

وَاِنَّهُمْ لَيَصُدُّونَهُمْ عَنِ السَّبِيلِ وَيَحْسَبُونَ اَنَّهُمْ مُهْتَدُونَ ﴿٣٧﴾ حَتّٰى اِذَا جَٓاءَنَا قَالَ يَا لَيْتَ بَيْنِي
وَبَيْنَكَ بُعْدَ الْمَشْرِقَيْنِ فَبِئْسَ الْقَرِينُ ﴿٣٨﴾ وَلَنْ يَنْفَعَكُمُ الْيَوْمَ اِذْ ظَلَمْتُمْ اَنَّكُمْ فِي الْعَذَابِ
مُشْتَرِكُونَ﴿٣٩﴾ اَفَاَنْتَ تُسْمِعُ الصُّمَّ اَوْ تَهْدِي الْعُمْيَ وَمَنْ كَانَ فِي ضَلَالٍ مُبِينٍ ﴿٤٠﴾ فَاِمَّا
نَذْهَبَنَّ بِكَ فَاِنَّا مِنْهُمْ مُنْتَقِمُونَ ﴿٤١﴾

---

**na gəlməz.** (Necə ki, şeytan müşriklərə sahib olub, onlar Qurani-Şərif"dən üz döndərib, batin gözləri haqqı görməz olubdur).

**37) (وَاِنَّهُمْ لَيَصُدُّونَهُمْ عَنِ السَّبِيلِ وَيَحْسَبُونَ اَنَّهُمْ مُهْتَدُونَ) - Şeytanlar vəsvəsə verib, müşriklərin haqq yoluna tabe olub müvəhhid olmalarına mane olurlar. Lakin onlar elə xəyal və güman edirlər ki, hidayət tapıb haqq üzrə sabit və bərqərardırlar.**

**38) (حَتّٰى اِذَا جَٓاءَنَا) - O vaxta qədər müşrik şeytana tabe olur ki, ölüm onu ziyarət edib bizim tərəfimizə gələr, o vaxt da əməllərinin qəbahəti və şeytanın ona düşmən olması ondan ötrü aydın olar.**

**(قَالَ يَا لَيْتَ بَيْنِي وَبَيْنَكَ بُعْدَ الْمَشْرِقَيْنِ فَبِئْسَ الْقَرِينُ) - O vaxt da şeytandan üz döndərib deyər: "Kaş bizim aramızda şərqdən qərbə qədər uzaq məsafə olaydı ki, mən səni görməyəydim. Nə pis yoldaşsan, məni zəlalətə salıb əzaba düçar etdin.**

**39) (وَلَنْ يَنْفَعَكُمُ الْيَوْمَ اِذْ ظَلَمْتُمْ) - Bugünkü gündə** (qiyamət günündə) **şeytandan çəkinib, ondan uzaq olmağı arzu etmək sizə fayda verməz. Çünki sizin zalım olmağınız aşkar oldu. Heç bir nəfərdən ötrü onda şəkk və şübhə qalmadı. (اَنَّكُمْ فِي الْعَذَابِ مُشْتَرِكُونَ) - Həqiqətən, siz və şeytanlarınız əzabda şəriksiniz və əzabdan xilas ola bilməyəcəksiniz.** (Allahın Rəsulu (ə.s) Qüreyş müşriklərini islama dəvət etmək üçün həddən çox səy edib, mübarək ruhuna sonsuz əziyyət verirdi ki, hidayət tapıb imana daxil olsunlar. Allah-Təala onların hidayətə gəlməsini özünəməxsus edib, peyğəmbərin təkbaşına onları hidayət etdirməyə qadir olmasını sıradakı ayədə inkar edir).

**40) (اَفَاَنْتَ تُسْمِعُ الصُّمَّ اَوْ تَهْدِي الْعُمْيَ وَمَنْ كَانَ فِي ضَلَالٍ مُبِينٍ)** - (Ey Məhəmməd), **bəs sən haqqı eşitməyə kar olan şəxsə haqq sözləri eşitdirməyə, ya da ki, haqqı görməkdən gözləri kor və aşkar zəlalətdə olan şəxsləri haqq tərəfinə hidayət etməyə qadirsənmi? Əlbəttə, sən təkbaşına qadir deyilsən, bəlkə Allah-Təala qadirdir. Əbəs yerə müşrikləri dəvət etməkdə özünə həddən çox zəhmət vermə.**

**41) (فَاِمَّا نَذْهَبَنَّ بِكَ فَاِنَّا مِنْهُمْ مُنْتَقِمُونَ)** - (Ey Məhəmməd), **əgər müşriklərə əzab göndərməmiş sənin ruhunu alıb, dünyadan köçürtsək də xatircəm ol, hərçənd sən görməsən də, biz həqiqətən, müşriklərə əzab göndərib onlardan intiqam alacağıq.**

اَوْ نُرِيَنَّكَ الَّذِي وَعَدْنَاهُمْ فَاِنَّا عَلَيْهِمْ مُقْتَدِرُونَ ﴿٤٢﴾ فَاسْتَمْسِكْ بِالَّذِيَ اُوحِيَ اِلَيْكَ اِنَّكَ عَلٰى صِرَاطٍ مُسْتَقِيمٍ ﴿٤٣﴾

---

**42) (اَوْ نُرِيَنَّكَ الَّذِي وَعَدْنَاهُمْ فَاِنَّا عَلَيْهِمْ مُقْتَدِرُونَ) - Ya da ki dünyada sənin həyatında müşriklərə vəd etdiyimiz əzabı sənə göstərib səni şad edərik. Həqiqətən, biz onlara əzab göndərməyə qadirik. Onlar bizim qüdrətimizdən qaçıb, əzabdan xilas ola bilməzlər.** (Allah-Təala bilirdi ki, müşriklərə əzab göndərib, Bədirdə onları məğlub etməklə peyğəmbərini və möminləri şad edəcəkdir. Lakin bu ayədə və bundan başqa bir çox ayədə bu işi gizli saxlayır. Ta ki, uca peyğəmbər qorxu ilə ümid arasında olub, fəth və zəfəri düşünərək axırda fövqəladə dərəcədə fərəh və sevinc hissinə qovuşa bilsin).

**43) (فَاسْتَمْسِكْ بِالَّذِيَ اُوحِيَ اِلَيْكَ اِنَّكَ عَلٰى صِرَاطٍ مُسْتَقِيمٍ)** - (Ey Məhəmməd), **müşriklərə qalib olub fəth etməyi sənə göstərdik, ya göstərmədik, sən öz işində* sabit və bərqərar olub, sənə vəhy olunan Qurana möhkəm yapışıb əməl et. Həqiqətən, sən dürüst və haqqa götürən yoldasan. Ancaq zəlalət və pislik içində olan şəxslər o yoldan kənar olar. Bizim dinimizi mühafizə və himayə etməkdə günbəgün möhkəmliyini artır. Dini təbliğ etmədə heç vaxt zəiflik və süstlük göstərmə.**

**(*Qeyd:** *"Bu əmrləri uca peyğəmbərə bildirməkdə məqsəd bunları islam ümmətinin rəisləri üçün əbədi bir qanun halına salmaqdır. Yəni islam dininin dəvətçiləri dini təbliğ etmə işində möhkəm olub, heç bir hərəkət verənin yerindən ayıra bilmədiyi qayalar kimi haqq yoluna dəvət etmədə sabit və bərqərar olsunlar və heç bir qınayanın, təhqir edənin mənasız və boş sözlərinə etina etməyib Qurani-Şərifin açıq-aydın ayələrini necə ki, uca yaradıcının məqsədidir, xalqa yetirsinlər. Lakin bizim bu zamanda cahilliyin zirvəyə çıxması ilə bunun əksi olub, Qurani-Şərifin uca ehkamı örtülü qalıb özünü alim adlandıran riyakar və bədniyyətlər xalqın Qurani-Şərifin ehkamını öyrənib, incəliklərini anlamasına mane olub, Quranın qəliz və müəmma bir şey olduğunu onlara bildirib, göstərirlər ki, heç kim Quranın mənasını bilmir, belə ki, Quranın günəş kimi cəhalət və nadanlığı dəf edən uca məzmunu ortaya çıxmayıb, onların məkr və hiylələri, riyakarlıq və oyunları rəvac tapıb, beş günlük ömürlərində avam xalqı özlərinə ram edib, fani dünya malından ləzzət alsınlar. Mən həqir ki, bu kitabın 3-cü cildinin yazılması ilə məşğulam, avam xalq arasında həmin məkr və hiylə sahiblərinin təlimi ilə ortaya çıxan sözlərdən eşitdiklərimdən biri budur ki, deyirlər: "Necə ola bilər ki, Quran türk dilinə təfsir və tərcümə olunsun, belə şey ola bilməz". Ağıl sahiblərinin bu işə dürüst diqqət edib, onlara belə məkr və hiylələri dəf etməyi tövsiyə edirəm. Görəsən elmin dilinin fərqi varmı? Elm odur ki, hər bir dildə yaysan da, əsli dəyişməz. Qurani-Şərifin uca dərəcəsindəndir ki, onun uca məzmununu hər hansı bir*

وَاِنَّهُ لَذِكْرٌ لَكَ وَلِقَوْمِكَ وَسَوْفَ تُسْـَٔلُونَ ﴿٤٤﴾ وَسْـَٔلْ مَنْ اَرْسَلْنَا مِنْ قَبْلِكَ مِنْ رُسُلِنَٓا اَجَعَلْنَا مِنْ
دُونِ الرَّحْمٰنِ اٰلِهَةً يُعْبَدُونَ ﴿٤٥﴾ وَلَقَدْ اَرْسَلْنَا مُوسٰى بِاٰيَاتِنَٓا اِلٰى فِرْعَوْنَ وَمَلَا۬ئِهٖ فَقَالَ اِنّ۪ي رَسُولُ
رَبِّ الْعَالَم۪ينَ ﴿٤٦﴾ فَلَمَّا جَٓاءَهُمْ بِاٰيَاتِنَٓا اِذَا هُمْ مِنْهَا يَضْحَكُونَ ﴿٤٧﴾ وَمَا نُر۪يهِمْ مِنْ اٰيَةٍ اِلَّا هِيَ
اَكْبَرُ مِنْ اُخْتِهَاۘ وَاَخَذْنَاهُمْ بِالْعَذَابِ لَعَلَّهُمْ يَرْجِعُونَ ﴿٤٨﴾

---

*dilə çevirəndə, daha da qədir-qiyməti artıb, nuru çoxalar. Sapqınlar istəməsə də, Allah nurunu tamamlacaqdır).*

**44) (وَاِنَّهُ لَذِكْرٌ لَكَ وَلِقَوْمِكَ وَسَوْفَ تُسْـَٔلُونَ)** - (Ey Məhəmməd), **həqiqətən, Qurani-Şərif** (xüsusən) **sən və xalqın olan Qüreyş camaatından ötrü həmişəlik xatırlatma və böyük şərəfdir. Ondan möhkəm yapışıb, ona əməl edin. Əlbəttə, qiyamət günündə Qurani-Şərifin haqqını yerinə yetirib, ona təzim edib, əməl edib-etməməkdən sorğu-sual olunacaqsınız.**

**45) (وَسْـَٔلْ مَنْ اَرْسَلْنَا مِنْ قَبْلِكَ مِنْ رُسُلِنَٓا اَجَعَلْنَا مِنْ دُونِ الرَّحْمٰنِ اٰلِهَةً يُعْبَدُونَ)** - (Ey Məhəmməd), **səndən əvvəl bizim göndərdiyimiz peyğəmbərlərdən soruş.** (Yəni onların din və millətlərinə baxıb əhvalatlarını araşdır). **Görəsən, onlardan ötrü Rəhman olan Allah-Təaladan başqa məbudlar da seçmişdik ki, onlara ibadət olunsun? Heç bir peyğəmbərin ümmətindən ötrü Allah-Təaladan başqa məbud təyin etməmişik. Habelə sənin ümmətindən ötrü də yeganə Allah-Təaladan başqa məbud yoxdur, bəs niyə bütlərə sitayiş edib Allah-Təalaya şərik qoşurlar?**

**46) (وَلَقَدْ اَرْسَلْنَا مُوسٰى بِاٰيَاتِنَٓا اِلٰى فِرْعَوْنَ وَمَلَا۬ئِهٖ فَقَالَ اِنّ۪ي رَسُولُ رَبِّ الْعَالَم۪ينَ) - O əvvəlki peyğəmbərlərdən biri də Musadır. Həqiqətən, Musanı firon və onun səltənətinə yardımçı olan böyük şəxslərə peyğəmbər göndərdik. Ta ki, onları bizim tərəfimizə dəvət etsin. Musa gedib, firon və ona tabe olanlara dedi: "Həqiqətən, mən aləmlərin rəbbi və tərbiyə verəni Allah-Təaladan sizə peyğəmbər gəlmişəm. Gəlin yeganə Allah-Təalaya sitayiş edin.**

**47) (فَلَمَّا جَٓاءَهُمْ بِاٰيَاتِنَٓا اِذَا هُمْ مِنْهَا يَضْحَكُونَ)** - (Musadan) **sözünün haqq olmağına dəlil və sübut istədilər. Biz də Musaya dəlil və sübut verdik. O zaman ki, Musa bizim dəlil və sübutlarımızla onlara gedib dəvət etdi, qəbul etməyib, istehza edib güldülər.**

**48) (وَمَا نُر۪يهِمْ مِنْ اٰيَةٍ اِلَّا هِيَ اَكْبَرُ مِنْ اُخْتِهَاۘ)** - (Ey Məhəmməd), **nə qədər dəlil və sübutları onlara göstərdik, o sübutlarda heç bir fərq yox idi. Lakin baxan şəxs güman edərdi ki, o sübutların hər biri o birindən böyükdür. Belə sübutların heç birini qəbul etmədilər. (وَاَخَذْنَاهُمْ بِالْعَذَابِ لَعَلَّهُمْ يَرْجِعُونَ) - Onlara hər cür əzab etdik ki, bəlkə qayıdıb, küfrdən tövbə edib, müvəhhid olsunlar, amma qayıtmayıb, küfrlərində qaldılar.**

وَقَالُوا يَٓا اَيُّهَ السَّاحِرُ ادْعُ لَنَا رَبَّكَ بِمَا عَهِدَ عِنْدَكَ اِنَّنَا لَمُهْتَدُونَ ﴿٤٩﴾ فَلَمَّا كَشَفْنَا عَنْهُمُ الْعَذَابَ اِذَا هُمْ يَنْكُثُونَ ﴿٥٠﴾ وَنَادٰى فِرْعَوْنُ فٖي قَوْمِهٖ قَالَ يَا قَوْمِ اَلَيْسَ لٖي مُلْكُ مِصْرَ وَهٰذِهِ الْاَنْهَارُ تَجْرٖي مِنْ تَحْتٖيۚ اَفَلَا تُبْصِرُونَۜ ﴿٥١﴾ اَمْ اَنَا۬ خَيْرٌ مِنْ هٰذَا الَّذٖي هُوَ مَهٖينٌ وَلَا يَكَادُ يُبٖينُ ﴿٥٢﴾ فَلَوْلَٓا اُلْقِيَ عَلَيْهِ اَسْوِرَةٌ مِنْ ذَهَبٍ اَوْ جَٓاءَ مَعَهُ الْمَلٰٓئِكَةُ مُقْتَرِنٖينَ ﴿٥٣﴾

---

**49) (وَقَالُوا يَٓا اَيُّهَ السَّاحِرُ ادْعُ لَنَا رَبَّكَ بِمَا عَهِدَ عِنْدَكَ اِنَّنَا لَمُهْتَدُونَ) - Fironun xalqı Musaya dedi: "Ey sehrdə kamil olan, o əhdə görə ki, sənin rəbbin Allah-Təala sənin yanında qərar veribdir,** (yəni sənin dualarını qəbul etsin), **rəbbin Allah-Təalaya dua et ki, bizə nicat verib, bizdən bəlanı dəf etsin, əgər bəlanı bizdən dəf etsə, həqiqətən, biz əlbəttə, haqq tərəfinə hidayət taparıq.** (Dilləri ilə hidayət gəlmə vədi verib, qəlbləri onun xilafına olduğu üçün Musaya sehrbaz dedilər). **Cənab Musa dua edib, bəla onlardan dəf oldu. Lakin hidayət tapmayıb, iman etmədilər. Necə ki, növbəti ayədə xəbər verir.**

**50) (فَلَمَّا كَشَفْنَا عَنْهُمُ الْعَذَابَ اِذَا هُمْ يَنْكُثُونَ) -** (Ey Məhəmməd), **o zaman ki, Musanın duası ilə əzabı onlardan dəf etdik, əhdlərini pozub, iman etməyib, küfrlərində israr etdilər.**

**51) (وَنَادٰى فِرْعَوْنُ فٖي قَوْمِهٖ قَالَ يَا قَوْمِ اَلَيْسَ لٖي مُلْكُ مِصْرَ وَهٰذِهِ الْاَنْهَارُ تَجْرٖي مِنْ تَحْتٖيۚ) - Firon öz xalqı arasında səslənib, onları çağırıb dedi: "Misirin səltənəti və bu çaylar ki, mənim qəsrimin altından axır, bəs bunlar mənə məxsus deyilmi? Bəs niyə Musa gəlib, mənə etiraz edib, istəyir mənə hökmranlıq etsin?**

**(اَفَلَا تُبْصِرُونَۜ)** - (Xəlifə Harun ər-Rəşid bu ayəni oxuyub dedi: "Firon Misirlə fəxr etdi. Mən oraya ən əskik qulamımı vali edərəm. Tualetə su daşıyan Xəsib adlı qulamını Misirə vali göndərdi).

**52) (اَمْ اَنَا۬ خَيْرٌ مِنْ هٰذَا الَّذٖي هُوَ مَهٖينٌ) - Bəlkə baxıb görərsiniz ki, mən bu zəif və həqir Musadan yaxşıyam.**

**Firon deyir: (وَلَا يَكَادُ يُبٖينُ) - "Aydın danışıb mətləbini bəyan edə bilməyən bir şəxs necə peyğəmbər olar? (Cənab Musanın dilində pəltəklik olduğundan yaxşı, açıq danışa bilməzdi).**

**53) (فَلَوْلَٓا اُلْقِيَ عَلَيْهِ اَسْوِرَةٌ مِنْ ذَهَبٍ اَوْ جَٓاءَ مَعَهُ الْمَلٰٓئِكَةُ مُقْتَرِنٖينَ) - Əgər bu** (Musa) **doğru deyirsə ki, Allah-Təala tərəfindən gəlibdir, nədən ötrü Allah-Təala tərəfindən ona qızıldan qolbaqlar taxılmayıbdır.** (Necə ki, biz hər bir şəxsə hakimiyyət verəndə onun əllərinə qızıldan qolbaqlar keçirib, boynuna qızıldan bir qotaz salarıq). **Ya da ki, niyə mələklər bir-birilərinə yaxın olduqları halda onunla birlikdə gəlib, onun doğruluğuna şəhadət etmirlər?**

فَاسْتَخَفَّ قَوْمَهُ فَاَطَاعُوهُ ۚ اِنَّهُمْ كَانُوا قَوْمًا فَاسِقِينَ ﴿٥٤﴾ فَلَمَّآ اٰسَفُونَا انْتَقَمْنَا مِنْهُمْ فَاَغْرَقْنَاهُمْ اَجْمَعِينَ ۙ ﴿٥٥﴾ فَجَعَلْنَاهُمْ سَلَفًا وَمَثَلًا لِلْاٰخِرِينَ ۠ ﴿٥٦﴾ وَلَمَّا ضُرِبَ ابْنُ مَرْيَمَ مَثَلًا اِذَا قَوْمُكَ مِنْهُ يَصِدُّونَ ﴿٥٧﴾ وَقَالُوٓا ءَاٰلِهَتُنَا خَيْرٌ اَمْ هُوَ ۚ مَا ضَرَبُوهُ لَكَ اِلَّا جَدَلًا ۚ بَلْ هُمْ قَوْمٌ خَصِمُونَ ﴿٥٨﴾ اِنْ هُوَ اِلَّا عَبْدٌ اَنْعَمْنَا عَلَيْهِ وَجَعَلْنَاهُ مَثَلًا لِبَنِيٓ اِسْرَآءِيلَ ۚ ﴿٥٩﴾ وَلَوْ نَشَآءُ لَجَعَلْنَا مِنْكُمْ مَلٰٓئِكَةً فِي الْاَرْضِ يَخْلُفُونَ ﴿٦٠﴾

---

**54)** (فَاسْتَخَفَّ قَوْمَهُ فَاَطَاعُوهُ ۚ اِنَّهُمْ كَانُوا قَوْمًا فَاسِقِينَ) - (Ey Məhəmməd), **firon bu sözlərlə xalqını haqqa tabe olmaqdan azdırıb, özünə meyl etdirdi. Ona itaət edib, Musanı təkzib etdilər, həqiqətən, onlar günahkar camaat idilər.**

**55)** (فَلَمَّآ اٰسَفُونَا انْتَقَمْنَا مِنْهُمْ فَاَغْرَقْنَاهُمْ اَجْمَعِينَ) - (Ey Məhəmməd), **o zaman ki, fironun xalqı bizə asi olmaqda ifrat edib, həddi aşıb, bizim əzab etməyimizə bais oldular, onlardan intiqam alıb, hamısını (suda) qərq etdik.**

**56)** (فَجَعَلْنَاهُمْ سَلَفًا وَمَثَلًا لِلْاٰخِرِينَ) **- Fironun xalqını onlardan sonra gələnlərdən ötrü ibrət və məsəl etdik ki, onlarla misal verib deyərlər: filan xalqa fironun xalqı kimi əzab edildi.** (Qüreyş camaatından Abdullah ibn Zibə`ra) **Allahın Rəsuluna dedi:** (Ey Məhəmməd), **sən ki, deyirsən, Allah-Təaladan başqa ibadət edən şeyləriniz də sizinlə birlikdə, hamınız cəhənnəmdə olacaqsınız, xristianlar ki, İsaya ibadət edirlər, gərək İsa da cəhənnəmdə olsun, halbuki sən İsanı vəsf edib təsdiq edirsən, bu sözü deyib, bir neçə nəfər də onunla birlikdə qəhqəhə çəkib, şad oldular. O vaxt da bu sonrakı ayə gəldi.**

**57)** (وَلَمَّا ضُرِبَ ابْنُ مَرْيَمَ مَثَلًا اِذَا قَوْمُكَ مِنْهُ يَصِدُّونَ) - (Ey Məhəmməd), **o zaman ki,** (Abdullah ibn Zibə`ra) **Məryəm oğlunu məsəl çəkib, səninlə mübahisə etdi. O vaxt baxıb görərsən ki, sənin xalqın** (Qüreyş camaatı) **o məsəl səbəbi ilə sevinc və şadlıq izhar edirlər. Guya sən o məsəldən məğlub olubsan.**

**58)** (وَقَالُوٓا ءَاٰلِهَتُنَا خَيْرٌ اَمْ هُوَ) **Dedilər sənə - bəs bizim bütlərimiz yaxşıdır, ya İsa? Əlbəttə, sənin yanında İsa yaxşıdır. O cəhənnəmə daxil olandan sonra bizim bütlərimizin işi asandır.** (مَا ضَرَبُوهُ لَكَ اِلَّا جَدَلًا ۚ بَلْ هُمْ قَوْمٌ خَصِمُونَ) - (Ey Məhəmməd), **İsanı ancaq səninlə mübahisə edib, batil sözlərini yaymaq üçün məsəl çəkdilər. Çünki onlar bilirlər, sənin cəhənnəmliklərdən məqsədin bütlərdir, nəinki İsa Məryəm oğlu, ancaq onlar bir camaatdırlar ki, adətləri həmişə inadkarlıq olub, şiddətlə mübahisə edəndirlər.**

**59-60)** (اِنْ هُوَ اِلَّا عَبْدٌ اَنْعَمْنَا عَلَيْهِ وَجَعَلْنَاهُ مَثَلًا لِبَنِيٓ اِسْرَآءِيلَ) - (Ey Məhəmməd), **İsa Məryəm oğlu ancaq bizim bəndələrimizdən bir bəndədir. Ona nemət verib, peyğəmbərlik bəxş edib, atasız yaratdığımız üçün onu Bəni-İsraildən ötrü ibrət verən məsəl etdik. Belə ki, Allah-Təalanın qüdrətinə agah olsunlar.** (وَلَوْ نَشَآءُ لَجَعَلْنَا مِنْكُمْ مَلٰٓئِكَةً فِي الْاَرْضِ يَخْلُفُونَ) **- Ey müşriklər, əgər biz istəsək**

وَاِنَّهُ لَعِلْمٌ لِلسَّاعَةِ فَلَا تَمْتَرُنَّ بِهَا وَاتَّبِعُونِۜ هٰذَا صِرَاطٌ مُسْتَقِيمٌ﴿٦١﴾ وَلَا يَصُدَّنَّكُمُ الشَّيْطَانُۚ اِنَّهُ لَكُمْ عَدُوٌّ مُبِينٌ ﴿٦٢﴾ وَلَمَّا جَٓاءَ عِيسٰى بِالْبَيِّنَاتِ قَالَ قَدْ جِئْتُكُمْ بِالْحِكْمَةِ وَلِاُبَيِّنَ لَكُمْ بَعْضَ الَّذِي تَخْتَلِفُونَ فِيهِۚ فَاتَّقُوا اللّٰهَ وَاَطِيعُونِ﴿٦٣﴾ اِنَّ اللّٰهَ هُوَ رَبِّي وَرَبُّكُمْ فَاعْبُدُوهُۜ هٰذَا صِرَاطٌ مُسْتَقِيمٌ ﴿٦٤﴾ فَاخْتَلَفَ الْاَحْزَابُ مِنْ بَيْنِهِمْۚ فَوَيْلٌ لِلَّذِينَ ظَلَمُوا مِنْ عَذَابِ يَوْمٍ اَلِيمٍ﴿٦٥﴾

---

**sizi həlak edib, sizin əvəzinizə yer üzündə şəri əmr edən xəbis nəfsdən xali olan məlaikə sifətli məxluqlar yaradardıq.**

**Belə ki, sizi əvəz edib, bizə ibadət etsinlər. Belə bir məxluq yaratmağa bizim qüdrətimiz vardır, lakin əzəldən iradəmiz belə olub ki, siz insanlarda ağıl və nəfsi qarışdırıb, eyni ölçüdə edək. Ta ki hər bir şəxs öz ixtiyarı ilə küfr, ya imanın hansı birini seçsə, ona görə qarşılıq verilsin.**

**61) (وَاِنَّهُ لَعِلْمٌ لِلسَّاعَةِ فَلَا تَمْتَرُنَّ بِهَا وَاتَّبِعُونِۜ) - Həqiqətən, bu Quran qiyamət gününün vaqe olması elmini verən böyük vasitədir. Qiyamətin vaqe olmasına şəkk etməyib, mənə tabe olun. Bu Quranın haqq və doğru olmasından qiyamətin haqq olmasını dərk edin.**

**(هٰذَا صِرَاطٌ مُسْتَقِيمٌ) - Düz yol bu Qurani-Şərifdir. Ona tabe olub hidayət tapın.**

**62) (وَلَا يَصُدَّنَّكُمُ الشَّيْطَانُۚ اِنَّهُ لَكُمْ عَدُوٌّ مُبِينٌ) - Şeytan sizi Qurana tabe olmaqdan saxlamasın, həqiqətən, şeytan sizə ədavəti aşkar olan düşməndir. Gərək ondan çəkinəsiniz.**

**63) (وَلَمَّا جَٓاءَ عِيسٰى بِالْبَيِّنَاتِ)** - (Ey Məhəmməd), **o zaman ki, İsa doğruluğuna açıq-aşkar işarə olan dəlil və sübutlarla Bəni-İsrailə peyğəmbər gəldi, (قَالَ قَدْ جِئْتُكُمْ بِالْحِكْمَةِ وَلِاُبَيِّنَ لَكُمْ بَعْضَ الَّذِي تَخْتَلِفُونَ فِيهِۚ) - Bəni-İsrailə xitab edib dedi: "Ey Bəni-İsrail, həqiqətən, mən Allah-Təala tərəfindən göndərilib, sizə hikmətlə gəlmişəm ki, dində ixtilaf etdiyiniz ehkamın bəzisini sizdən ötrü bəyan edim.** (Qalan ehkamlarda yenə Tövrata tabesiniz). **(فَاتَّقُوا اللّٰهَ وَاَطِيعُونِ) Allah-Təaladan qorxub, mənə itaət edin ki, doğru adam olasınız.**

**64) (اِنَّ اللّٰهَ هُوَ رَبِّي وَرَبُّكُمْ فَاعْبُدُوهُۜ هٰذَا صِرَاطٌ مُسْتَقِيمٌ) - Həqiqətən, mənim və sizin rəbbiniz Allah-Təaladır. Ona ibadət edin. Yeganə Allah-Təalaya ibadət etmək nicat və doğru yoldur.**

**65) (فَاخْتَلَفَ الْاَحْزَابُ مِنْ بَيْنِهِمْۚ فَوَيْلٌ لِلَّذِينَ ظَلَمُوا مِنْ عَذَابِ يَوْمٍ اَلِيمٍ)** - (Ey Məhəmməd), **İsa ümməti neçə qrup olub,** (İsadan sonra) **öz aralarında İsa haqqında ixtilaf etdilər.** (Bəzisi ona Allah, bəzisi Allahın oğlu dedilər). **Bir günün əzabından** (qiyamət günü) **- hansı ki, o günün əzabı şiddətli və əziyyət verəndir, zalımlara vay olsun ki, necə şiddətli əzab onlara yetişəcəkdir.**

هَلْ يَنْظُرُونَ اِلَّا السَّاعَةَ اَنْ تَأْتِيَهُمْ بَغْتَةً وَهُمْ لَا يَشْعُرُونَ ﴿٦٦﴾ اَلْاَخِلَّاءُ يَوْمَئِذٍ بَعْضُهُمْ لِبَعْضٍ عَدُوٌّ
اِلَّا الْمُتَّقِينَ ﴿٦٧﴾ يَا عِبَادِ لَا خَوْفٌ عَلَيْكُمُ الْيَوْمَ وَلَٓا اَنْتُمْ تَحْزَنُونَ ﴿٦٨﴾ اَلَّذِينَ اٰمَنُوا بِاٰيَاتِنَا
وَكَانُوا مُسْلِمِينَ ﴿٦٩﴾ اُدْخُلُوا الْجَنَّةَ اَنْتُمْ وَاَزْوَاجُكُمْ تُحْبَرُونَ ﴿٧٠﴾ يُطَافُ عَلَيْهِمْ بِصِحَافٍ مِنْ
ذَهَبٍ وَاَكْوَابٍ وَفِيهَا مَا تَشْتَهِيهِ الْاَنْفُسُ وَتَلَذُّ الْاَعْيُنُ وَاَنْتُمْ فِيهَا خَالِدُونَ ﴿٧١﴾ وَتِلْكَ الْجَنَّةُ الَّتِي
اُورِثْتُمُوهَا بِمَا كُنْتُمْ تَعْمَلُونَ ﴿٧٢﴾ لَكُمْ فِيهَا فَاكِهَةٌ كَثِيرَةٌ مِنْهَا تَأْكُلُونَ ﴿٧٣﴾

---

**66) (هَلْ يَنْظُرُونَ اِلَّا السَّاعَةَ اَنْ تَأْتِيَهُمْ بَغْتَةً وَهُمْ لَا يَشْعُرُونَ)** - (Ey Məhəmməd), **kafir və müşriklər gözləyirlər ki, qəfildən və dünya işləri ilə məşğul olub qafil olduqları halda qiyamət onlara gəlsin? Hərçənd intizar çəkmələri istehzadan ötrüdür, lakin həqiqətən qiyamət gəlib, o vaxt da bizim əzabımızdan xilas ola bilməzlər.**

**67) (اَلْاَخِلَّاءُ يَوْمَئِذٍ بَعْضُهُمْ لِبَعْضٍ عَدُوٌّ اِلَّا الْمُتَّقِينَ)** - (Ey Məhəmməd), **dünyada küfr və günahda dost olanlar qiyamət günündə bir-birilərinə düşmən olarlar, ancaq müttəqilərin bir-biri ilə olan dostluğu axirətdə daha da artar.**

**68) (يَا عِبَادِ لَا خَوْفٌ عَلَيْكُمُ الْيَوْمَ وَلَٓا اَنْتُمْ تَحْزَنُونَ) - Qiyamət günündə möminlərə səslənib, onlara deyərəm: “Ey mənim bəndələrim, bu günkü gündə sizı heç bir qorxu yoxdur. Qəmgin və üzgün də olmayacaqsınız.**

**69) (اَلَّذِينَ اٰمَنُوا بِاٰيَاتِنَا وَكَانُوا مُسْلِمِينَ) - Mənim xalis bəndələrim o şəxslərdir ki, bizim tərəfimizdən nazil olan ayələrə iman edib, nəfslərini bizim itaətimizə məxsus edərlər.**

**70) (اُدْخُلُوا الْجَنَّةَ اَنْتُمْ وَاَزْوَاجُكُمْ تُحْبَرُونَ) - Bəndələrimə mənim tərəfimdən xitab olunub deyilər: “Siz və xeyirli xanımlarınız cənnətə daxil olun. Cənnətdə elə şad olacaqsınız ki, o şadlığın izi sizin üzünüzdən bəlli olacaq.**

**71) (يُطَافُ عَلَيْهِمْ بِصِحَافٍ مِنْ ذَهَبٍ وَاَكْوَابٍ)** - (Ey Məhəmməd), **cənnətin xidmətçiləri qızıldan teştlərdə hər bir növ yemək və meyvələr və qızıldan kuzələrdə hər bir növ şərablar möminlərə dolandırıb verərlər.** (Tamah məqsədi ilə əməl edənlərə müjdə olsun).

**(وَفِيهَا مَا تَشْتَهِيهِ الْاَنْفُسُ وَتَلَذُّ الْاَعْيُنُ وَاَنْتُمْ فِيهَا خَالِدُونَ) Nəfsin istədiyi və gözə həzz verən hər bir şey cənnətdə mövcuddur və siz möminlər cənnətdə həmişəlik qalıb, oradan xaric olmazsınız.**

**72) (وَتِلْكَ الْجَنَّةُ الَّتِي اُورِثْتُمُوهَا بِمَا كُنْتُمْ تَعْمَلُونَ) - Bu cənnət həmin cənnətdir ki, siz möminlər dünyada etdiyiniz əməllər səbəbi ilə ona varis olubsunuz. Mal varisə məxsus olan kimi bu cənnət də sizə məxsus olub sizdən alınmayacaqdır.**

**73) (لَكُمْ فِيهَا فَاكِهَةٌ كَثِيرَةٌ مِنْهَا تَأْكُلُونَ) - Siz möminlərdən ötrü cənnətdə çox mey-**

اِنَّ الْمُجْرِمِينَ فِي عَذَابِ جَهَنَّمَ خَالِدُونَ ﴿٧٤﴾ لَا يُفَتَّرُ عَنْهُمْ وَهُمْ فِيهِ مُبْلِسُونَ ﴿٧٥﴾ وَمَا ظَلَمْنَاهُمْ وَلٰكِنْ كَانُوا هُمُ الظَّالِمِينَ﴿٧٦﴾ وَنَادَوْا يَا مَالِكُ لِيَقْضِ عَلَيْنَا رَبُّكَ قَالَ اِنَّكُمْ مَاكِثُونَ ﴿٧٧﴾ لَقَدْ جِئْنَاكُمْ بِالْحَقِّ وَلٰكِنَّ اَكْثَرَكُمْ لِلْحَقِّ كَارِهُونَ ﴿٧٨﴾ اَمْ اَبْرَمُوٓا اَمْرًا فَاِنَّا مُبْرِمُونَ ﴿٧٩﴾ اَمْ يَحْسَبُونَ اَنَّا لَا نَسْمَعُ سِرَّهُمْ وَنَجْوٰيهُمْ بَلٰى وَرُسُلُنَا لَدَيْهِمْ يَكْتُبُونَ﴿٨٠﴾ قُلْ اِنْ كَانَ لِلرَّحْمٰنِ وَلَدٌ فَاَنَاْ اَوَّلُ الْعَابِدِينَ ﴿٨١﴾

---

**vələr vardır. O meyvələrdən yeyirsiniz** (Burada cənnət əhlinin əhvalının bəyanı tamamlanıb, bundan belə cəhənnəm əhlinin əhvalının bəyanına başlanılır).

**74)** (اِنَّ الْمُجْرِمِينَ فِي عَذَابِ جَهَنَّمَ خَالِدُونَ) - (Ey Məhəmməd), **Allah-Təalaya asi və günahkar olanlar cəhənnəm əzabında həmişə olub xilas olmayacaqlar.**

**75)** (لَا يُفَتَّرُ عَنْهُمْ وَهُمْ فِيهِ مُبْلِسُونَ) **- Cəhənnəm əzabı onlardan yüngülləşdirilməyib, həmin əzabda qalıb nicat tapmaqdan ümidsiz olarlar.**

**76-77)** (وَمَا ظَلَمْنَاهُمْ وَلٰكِنْ كَانُوا هُمُ الظَّالِمِينَ) - (Ey Məhəmməd), **günahkarlara əzab etmək üçün biz onlara zülm etmədik, əksinə, onlar bizə asi olduqları üçün öz nəfslərinə zülm edib əzab olunmağa bais oldular.**

(وَنَادَوْا يَا مَالِكُ لِيَقْضِ عَلَيْنَا رَبُّكَ) **- Cəhənnəm əhli tərəfindən cəhənnəmin mühafizinə və rəisinə səslənib deyilər: "Ey malik, rəbbin Allah-Təaladan xahiş et ki, bizi həlak etsin. Ta ki, əzabdan xilas olaq.** (قَالَ اِنَّكُمْ مَاكِثُونَ) **- Cəhənnəm mühafizi onlara cavab verib deyər: "Həqiqətən, siz əzabda həmişəlik qalıb, sizə ölüm olmayacaqdır.**

**78)** (لَقَدْ جِئْنَاكُمْ بِالْحَقِّ وَلٰكِنَّ اَكْثَرَكُمْ لِلْحَقِّ كَارِهُونَ) **- Ey müşriklər, həqiqətən, haqq və ədalətlə sizə peyğəmbər (Məhəmmədi) göndərdik. Lakin sizin əksəriyyətiniz haqqı geriyə itib üz çevirirsiniz.**

**79)** (اَمْ اَبْرَمُوٓا اَمْرًا فَاِنَّا مُبْرِمُونَ) - (Ey Məhəmməd), **bəlkə müşriklər məkr, hiylələrindən birini öz aralarında möhkəm qət ediblər. Ta ki, sənə zərər yetirsinlər. Sən onlardan qorxma. Həqiqətən, biz onların müqabilində öz əmrimizi möhkəm və qəti etmişik. Ta ki, onları zəlil edib, səni onlara sahib edək.**

**80)** (اَمْ يَحْسَبُونَ اَنَّا لَا نَسْمَعُ سِرَّهُمْ وَنَجْوٰيهُمْ بَلٰى) - (Ey Məhəmməd), **bəlkə müşriklər elə güman edirlər ki, biz onların sirlərini və gizlincə bir-biriləri ilə danışmalarını eşitmirik, əlbəttə, eşidib, onların hər bir sözlərinə agahıq).** (وَرُسُلُنَا لَدَيْهِمْ يَكْتُبُونَ) **- Eşitməkdən əlavə, bizim tərəfimizdən göndərilən mühafizlər onların hər bir sirlərini və gizlin əməllərini yazıb mühafizə edirlər.**

**81)** (قُلْ اِنْ كَانَ لِلرَّحْمٰنِ وَلَدٌ فَاَنَاْ اَوَّلُ الْعَابِدِينَ) - (Ey Məhəmməd), **müşriklərə de ki,**

سُبْحَانَ رَبِّ السَّمٰوَاتِ وَالْاَرْضِ رَبِّ الْعَرْشِ عَمَّا يَصِفُونَ ﴿٨٢﴾ فَذَرْهُمْ يَخُوضُوا وَيَلْعَبُوا حَتّٰى يُلَاقُوا يَوْمَهُمُ الَّذٖي يُوعَدُونَ ﴿٨٣﴾ وَهُوَ الَّذٖي فِي السَّمَٓاءِ اِلٰهٌ وَفِي الْاَرْضِ اِلٰهٌ وَهُوَ الْحَكٖيمُ الْعَلٖيمُ ﴿٨٤﴾ وَتَبَارَكَ الَّذٖي لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَيْنَهُمَا وَعِنْدَهُ عِلْمُ السَّاعَةِ وَاِلَيْهِ تُرْجَعُونَ ﴿٨٥﴾ وَلَا يَمْلِكُ الَّذٖينَ يَدْعُونَ مِنْ دُونِهِ الشَّفَاعَةَ اِلَّا مَنْ شَهِدَ بِالْحَقِّ وَهُمْ يَعْلَمُونَ﴿٨٦﴾ وَلَئِنْ سَاَلْتَهُمْ مَنْ خَلَقَهُمْ لَيَقُولُنَّ اللّٰهُ فَاَنّٰى يُؤْفَكُونَ ﴿٨٧﴾

---

**siz ki deyirsiniz, məlaikə Allah-Təalanın qızlarıdırlar, əgər Rəhman olan Allah-Təalanın övladı olsaydı, mən ki Allah-Təalanın peyğəmbəriyəm, sizin hamınızdan əvvəl mən ona təzim və hörmət edib, ibadət edərəm. Çünki mənim rəbbimin övladıdır. İndi ki mən deyirəm, onun övladı yoxdur, niyə məni qəbul etməyib, ona övlad isnad edirsiniz?**

**82) (سُبْحَانَ رَبِّ السَّمٰوَاتِ وَالْاَرْضِ رَبِّ الْعَرْشِ عَمَّا يَصِفُونَ) - Göylərin, yerin və ərşin rəbbi Allah-Təala müşriklərin onu vəsf edib, övlad isnad etmələrindən pak və ucadır. Allah-Təalaya övlad layiq deyildir.**

**83) (فَذَرْهُمْ يَخُوضُوا وَيَلْعَبُوا حَتّٰى يُلَاقُوا يَوْمَهُمُ الَّذٖي يُوعَدُونَ)** - (Ey Məhəmməd), **indi ki, müşriklər səndən üz çevirirlər, sən də onları tərk edib, qoy batil işlərinə daxil olub, vəd edilən günü** (qiyamət gününü) **qarşılayana qədər dünyalarında əylənib oynasınlar. O gün onların cəzasını verəcəm.**

**84) (وَهُوَ الَّذٖي فِي السَّمَٓاءِ اِلٰهٌ وَفِي الْاَرْضِ اِلٰهٌ وَهُوَ الْحَكٖيمُ الْعَلٖيمُ) - Göylərdə və yerdə ibadətə layiq olan məbud yeganə Allah-Təaladır. Xalqın hər bir işini hikmət üzrə edib və faydalarından da agahdır.**

**85) (وَتَبَارَكَ الَّذٖي لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَيْنَهُمَا) - Bir Allah-Təala ki, göylərin, yerin və onların arasında olan hər bir şeyin səltənəti ona məxsusdur, onun xeyir və bərəkəti çoxdur, bütün məxluqata aiddir.**

**(وَعِنْدَهُ عِلْمُ السَّاعَةِ وَاِلَيْهِ تُرْجَعُونَ) Qiyamətin nə vaxt vaqe olacağı elmi Allah-Təaladadır. Hamınızın qayıdacağı yer onun tərəfinə olub, hər bir şəxsin əməlinə görə ona qarşılıq verəcəkdir.**

**86) (وَلَا يَمْلِكُ الَّذٖينَ يَدْعُونَ مِنْ دُونِهِ الشَّفَاعَةَ اِلَّا مَنْ شَهِدَ بِالْحَقِّ وَهُمْ يَعْلَمُونَ)** - (Ey Məhəmməd), **müşriklərin Allah-Təaladan başqa dua və ibadət etdiikləri bütləri onlardan ötrü şəfaətə malik olmazlar,** (necə ki onların etiqadlarıdır, bütlər onlardan ötrü şəfaət edəcəkdir). **Allah-Təalanın izni ilə şəfaətə o şəxslər malik olarlar ki, həqiqətən, məbudlarının yeganə Allah-Təala olduğuna agah olub, tövhidə şəhadət edib, müvəhhid olarlar.**

**87-88) (وَلَئِنْ سَاَلْتَهُمْ مَنْ خَلَقَهُمْ لَيَقُولُنَّ اللّٰهُ فَاَنّٰى يُؤْفَكُونَ)** - (Ey Məhəmməd), **əgər müşriklərdən soruşsan ki, onları kim yaradıbdır? Əlbəttə, deyəcəklər:**

وَقِيلِهِ يَا رَبِّ اِنَّ هٰؤُلَٓاءِ قَوْمٌ لَا يُؤْمِنُونَۘ ﴿٨٨﴾ فَاصْفَحْ عَنْهُمْ وَقُلْ سَلَامٌۜ فَسَوْفَ يَعْلَمُونَ ﴿٨٩﴾

---

**"Allah-Təala yaradıbdır. Bəs Allah-Təalanın ibadətindən dönüb, niyə bütlərə ibadət edirlər? (وَقِيلِهِ يَا رَبِّ اِنَّ هٰؤُلَٓاءِ قَوْمٌ لَا يُؤْمِنُونَ) -** (Sən ki, Məhəmmədsən), **Allah-Təala sənin sözünə agahdır ki, onu çağırıb deyirsən: "Ey mənim rəbbim, müşriklər iman etməyən bir camaatdır, bunlarda iman ümidi yoxdur.**

**89) (فَاصْفَحْ عَنْهُمْ وَقُلْ سَلَامٌۜ فَسَوْفَ يَعْلَمُونَ) -** (Ey Məhəmməd), **indi ki, onlar imana gələn deyildirlər, onlardan üz çevirib de: "Sizinlə mənim işim qurtardı, daha sizinlə işim yoxdur.** (Ey Məhəmməd), **onları tərk et. Əlbəttə, küfrlərinin aqibətinə agah olub, əzaba düçar olacaqlar.**

**Allaha həmd olsun, Zuxruf surəsinin təfsirinə müvəffəq olub tamamladım. Mütiləri müjdələyən, asiləri qorxudub xəbərdarlıq edən bir surədir. Allahın Rəsulu** (ə.s) **buyurubdur: "Kim Zuxruf surəsini oxusa, qiyamət günündə Allah-Təalanın - Ey mənim bəndələrim, bugünkü gündə sizə qorxu yoxdur və üzgün də olmazsınız, sorğu-sualsız cənnətə daxil olun, xitabını eşidəcəklər.**

## əd-DUXAN SURƏSİ

44-cü surədir. Məkkədə nazil olub, 57 ayə, 346 kəlmə və 1431 hərfdir.

حٰمٓ ﴿١﴾ وَالْكِتَابِ الْمُبِينِ ﴿٢﴾ اِنَّٓا اَنْزَلْنَاهُ فٖي لَيْلَةٍ مُبَارَكَةٍ اِنَّا كُنَّا مُنْذِرٖينَ ﴿٣﴾ فٖيهَا يُفْرَقُ كُلُّ اَمْرٍ حَكٖيمٍ ﴿٤﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (حٰمٓ) - Bu mübarək surənin adıdır.**

**2) (وَالْكِتَابِ الْمُبِينِ)** - (Ey Məhəmməd), **and olsun bu Qurana ki, xalqın din və dünya işlərini bəyan edəndir.**

**3) (اِنَّٓا اَنْزَلْنَاهُ فٖي لَيْلَةٍ مُبَارَكَةٍ) - Həqiqətən, biz bu Quranı xeyir-bərəkəti çox olan bir gecədə* nazil etdik. (اِنَّا كُنَّا مُنْذِرٖينَ) - Həqiqətən, biz asiləri əzabımızla qorxuduruq ki, şirki tərk edib, müvəhhid olsunlar.**

**(*Qeyd:** *"Ayədə vaqe olan gecənin barəsində təfsirçilər müxtəlif sözlər deyiblər. Bəzisi Qədir gecəsi, bəzisi Şaban ayının yarı gecəsi (Bəraət gecəsi) deyib ki, bu gecələr xeyirli və bərəkətli gecələrdir. Əsl mətləbdən uzaq düşüb belə sözlər deyiblər. Ayədə bəhs olunan mübarək gecə nə qədir gecəsi, nə də Şaban ayının yarı gecəsi deyildir. Əksinə, Qurani-Şərifin fəzilət və şərəfinə görə mübarək sayılıb, Qurani-Şərifin nazil olduğu gecədir. Qurani-Şərif kainat var olduqca, qiyamətə kimi hidayət edən, Allah-Təala tərəfindən həqiqi dəvətçi olduğu üçün onun ilk nazil olduğu gecə mübarək gecə sayıldı. Belə böyük faydalı mənanı qoyub faydasız sözlər danışmaqdan nə nəticə hasil olur? Allahın Rəsulu (ə.s) Məkkədə Hira dağında guşənişin olan zamanda Ramazan ayının 24-cü gecəsində gecənin qaranlığında mağaranın bir guşəsində əbasına bürünüb, başı əbanın içində oturub, lakin yatmamışdı. Bir səs eşidib, bir nurani varlıq ona göründü. Allah-Təala tərəfindən mələk vasitəsi ilə (Ələq surəsinin) "Allahın adı ilə oxu..." ayəsi nazil olub, peyğəmbərliklə vəzifələndirildi. Həmin gecəni Allah-Təala mübarək gecə adlandırıb, dolayısı ilə o gecənin islam dinində ilk mötəbər gecə olduğunu biz cahil və nadan müsəlmanlara bildirir. Belə ki, o gecəyə təzim və hörmət edib, islam dininin başlanğıcı olduğu üçün müsəlmanlar o gecəyə diqqət edib, o gecənin ehtiramından qafil olmasınlar. Kaş mən biləydim ki, təfsirçilərin əksəriyyəti niyə Quranın incəliklərindən qafil olub, açıq-aydın ayələrə belə faydasız mənalar yükləyiblər. Ayələrin incəliklərini anlamağa müvəffəq edən Allah-Təaladır).*

**4) (فٖيهَا يُفْرَقُ كُلُّ اَمْرٍ حَكٖيمٍ) - Quran o gecədə gəlməyə başladığı üçün hikməti ehtiva edən bütün əmrlər bir-birindən aralanıb insanlar üçün hökmlər verildi.**

اَمْرًا مِنْ عِنْدِنَاۜ اِنَّا كُنَّا مُرْسِلِينَۚ ﴿٥﴾ رَحْمَةً مِنْ رَبِّكَۜ اِنَّهُ هُوَ السَّم۪يعُ الْعَل۪يمُۙ ﴿٦﴾ رَبِّ السَّمٰوَاتِ
وَالْاَرْضِ وَمَا بَيْنَهُمَاۢ اِنْ كُنْتُمْ مُوقِن۪ينَ ﴿٧﴾ لَٓا اِلٰهَ اِلَّا هُوَ يُحْيٖ وَيُم۪يتُۜ رَبُّكُمْ وَرَبُّ اٰبَٓائِكُمُ الْاَوَّل۪ينَ
﴿٨﴾ بَلْ هُمْ ف۪ي شَكٍّ يَلْعَبُونَ ﴿٩﴾ فَارْتَقِبْ يَوْمَ تَاْتِي السَّمَٓاءُ بِدُخَانٍ مُب۪ينٍۙ ﴿١٠﴾ يَغْشَى النَّاسَۜ
هٰذَا عَذَابٌ اَل۪يمٌ ﴿١١﴾

---

**5) (اَمْرًا مِنْ عِنْدِنَاۜ) - O əmrlər bizim tərəfimizdən bizim elm və tədbirimizlə gəldiyi halda insanlardan ötrü əbədi qanun edildi. (اِنَّا كُنَّا مُرْسِلِينَ) - Həqiqətən, peyğəmbər göndərib ehkam vermək bizim şanımızdır. Necə ki keçən zamanlarda peyğəmbər göndərib onlardan ötrü ehkam təyin etmişdik. Bu Məhəmməd də onlardan bir peyğəmbərdir. Onu göndərib, ondan ötrü də ehkam təyin etmişik.**

**6) (رَحْمَةً مِنْ رَبِّكَۜ اِنَّهُ هُوَ السَّم۪يعُ الْعَل۪يمُ) -** (Ey Məhəmməd), **kitab və peyğəmbər göndərmək sənin rəbbin Allah-Təaladan bəndələrinə rəhmət və mərhəmətdir. Həqiqətən, Allah-Təala insanların sözlərini eşidib, hər bir hallarına agahdır.**

**7) (رَبِّ السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَيْنَهُمَاۢ اِنْ كُنْتُمْ مُوقِن۪ينَ) - Əgər siz müşriklər, göylərin və yerin yaradıcısının Allah-Təala olduğunu iqrar edirsinizsə, o, həmin Allah-Təaladır ki, kitab** (Quran) **göndərib, sizi öz tərəfinə dəvət edir.** (Çünki müşriklər göylərin və yerin yaradıcısının Allah-Təala olduğunu zahirən iqrar edib, kitab və peyğəmbər göndərməsini inkar edirdilər).

**8) (لَٓا اِلٰهَ اِلَّا هُوَ يُحْيٖ وَيُم۪يتُۜ رَبُّكُمْ وَرَبُّ اٰبَٓائِكُمُ الْاَوَّل۪ينَ) - Yeganə Allah-Təaladan başqa haqq məbud yoxdur. Dirildib öldürmək onun sifətidir. Belə dirildib öldürən Allah-Təala siz müşriklərin və keçmiş ata-babalarınızın tərbiyə verənidir, nədən ötrü ondan üz çevirib, bütlərə sitayiş edirsiniz?**

**9) (بَلْ هُمْ ف۪ي شَكٍّ يَلْعَبُونَ) -** (Ey Məhəmməd), **hərçənd kafirlər zahirdə iqrar edirlər ki, göylərin və yerin yaradıcısı Allah-Təaladır, lakin bu iqrarları elm və inanc üzrə deyildir. Bəlkə şəkk içində olub, əylənib, istehza edirlər.**

**10) (فَارْتَقِبْ يَوْمَ تَاْتِي السَّمَٓاءُ بِدُخَانٍ مُب۪ينٍۙ) -** (Ey Məhəmməd), **gözlə o günü ki, göyü açıq-aşkar duman bürüyüb, müşriklərə bəla gələcək. Elə ki,Məkkə müşrikləri Allahın Rəsuluna itaət etməyib, ona əziyyət etməkdə həddi aşdılar, Allah-Təala onlara qəhətliyi düçar edib, yeməkləri bitdi. Aclığın şiddətindən sanki aralarını duman bürümüş kimi gözləri bir-birini görmürdü. Allah-Təala bu əzabı əvvəlcədən Allahın Rəsuluna xəbər verir.**

**11) (يَغْشَى النَّاسَۜ هٰذَا عَذَابٌ اَل۪يمٌ) - Onların gözlərini dumanlandıran aclıq onları saracaqdır. Müşriklər bir-birilərinə deyərlər: "Budur əziyyət verən əzab bizi tutub, hamımız aclıqdan həlak olacağıq".**

رَبَّنَا اكْشِفْ عَنَّا الْعَذَابَ اِنَّا مُؤْمِنُونَ﴿١٢﴾ اَنّٰى لَهُمُ الذِّكْرٰى وَقَدْ جَٓاءَهُمْ رَسُولٌ مُبٖينٌۙ ﴿١٣﴾ ثُمَّ
تَوَلَّوْا عَنْهُ وَقَالُوا مُعَلَّمٌ مَجْنُونٌۢ ﴿١٤﴾ اِنَّا كَاشِفُوا الْعَذَابِ قَلٖيلًا اِنَّكُمْ عَٓائِدُونَۢ ﴿١٥﴾ يَوْمَ نَبْطِشُ
الْبَطْشَةَ الْكُبْرٰىۚ اِنَّا مُنْتَقِمُونَ ﴿١٦﴾ وَلَقَدْ فَتَنَّا قَبْلَهُمْ قَوْمَ فِرْعَوْنَ وَجَٓاءَهُمْ رَسُولٌ كَرٖيمٌۙ ﴿١٧﴾

---

**12) (رَبَّنَا اكْشِفْ عَنَّا الْعَذَابَ اِنَّا مُؤْمِنُونَ) - Ondan sonra əzabın qorxusundan dua edib deyərlər: "Ey bizim rəbbimiz, bizdən əzabı götür, həqiqətən, biz iman edib, tövhidə iqrar edirik.**

**13) (اَنّٰى لَهُمُ الذِّكْرٰى وَقَدْ جَٓاءَهُمْ رَسُولٌ مُبٖينٌ)** - (Ey Məhəmməd), **müşriklər qorxularından iman etmək vədini verirlər. Amma onlar hara, haqqı dərk edib, iman etmək hara? Halbuki doğruluğu zahir və aşkar olan peyğəmbər** (Məhəmməd) **onlara gəldi. İnanmayıb, iman etmədilər. Qəhətlik səbəbinə ayılıb, iman edəcəklər? Sənin kimi Allah Rəsulundan ibrət almaq əzabdan ibrət almaqdan yaxşıdır. Amma səndən ibrət almayan əzabdan heç ibrət almaz.**

**14) (ثُمَّ تَوَلَّوْا عَنْهُ وَقَالُوا مُعَلَّمٌ مَجْنُونٌ)** - (Ey Məhəmməd), **sən onlara göndəriləndən sonra səndən üz çevirib dedilər: "Bu** (Məhəmməd) **başqasından* təlim alır. Özü də dəlidir.** (Taif əhlindən Məkkədə olan bir kişinin Əddas adlı bir əcəm qulamı var idi. Deyirdilər ki, Məhəmməd o qulamdan təlim alır).

**(*Qeyd:** *"Həqiqətən Məkkəli Qüreyş müşriklərinin uca peyğəmbərimizə olan düşmənçilikləri, kin, ədavət, nifaqları çox böyük idi. Ona dəli deyib, sonra da təlim aldı demək nə mənasız, təəccüblü bir sözdür. Bunlardan əlavə fəsahət və bəlağətin ən yüksək dərəcəsində olan Qurani-Şərifi bir əcəm qulamına isnad etmək daha çox təəccüblüdür. Qüreyş camaatının həmin mənasız və xurafat sözləri Qurani-Şərifin müqabilində onların necə aciz və Allah Rəsulunun necə haqlı olduğunu ağıl sahibləri yanında aşkar edir).*

**15) (اِنَّا كَاشِفُوا الْعَذَابِ قَلٖيلًا اِنَّكُمْ عَٓائِدُونَ) - Ey müşriklər, sizin dua etməyinizə görə az bir müddət içində qəhətlik əzabını sizdən dəf edərik. Əzabı sizdən götürən kimi şirk halətinə qayıdıb, yenə müşrik olacaqsınız.** (Ondan sonra sizə başqa bir əzab (Bədir əzabını) göndərərik).

**16) (يَوْمَ نَبْطِشُ الْبَطْشَةَ الْكُبْرٰىۚ اِنَّا مُنْتَقِمُونَ)** - (Ey Məhəmməd), **o gündə ki,** (Bədir günündə) **biz müşriklərə böyük həmlə edərik, həqiqətən, o gün səni müşriklərə qalib edib, onları zəlil etməklə onlardan intiqam alacağıq. (Necə ki, qalib edib, intiqam aldı).**

**17) (وَلَقَدْ فَتَنَّا قَبْلَهُمْ قَوْمَ فِرْعَوْنَ وَجَٓاءَهُمْ رَسُولٌ كَرٖيمٌ)** - (Ey Məhəmməd), **bu müşriklərdən əvvəl fironun xalqını** (qibtiləri) **imtahan edib, onlara hər bir neməti verib, bol ruzi bəxş etdik. Lakin onlar şükür etməyib, tüğyan edib, bizə asi oldular. O vaxt da bizim yanımızda hörmətli olan peyğəmbərimiz** (Musa) **onlara bizim tərəfimizdən göndərildi.**

اَنْ اَدُّٓوا اِلَيَّ عِبَادَ اللّٰهِۜ اِنّ۪ي لَكُمْ رَسُولٌ اَم۪ينٌۙ ﴿١٨﴾ وَاَنْ لَا تَعْلُوا عَلَى اللّٰهِۚ اِنّ۪ٓي اٰت۪يكُمْ بِسُلْطَانٍ مُب۪ينٍۚ
﴿١٩﴾ وَاِنّ۪ي عُذْتُ بِرَبّ۪ي وَرَبِّكُمْ اَنْ تَرْجُمُونِۘ ﴿٢٠﴾ وَاِنْ لَمْ تُؤْمِنُوا ل۪ي فَاعْتَزِلُونِ﴿٢١﴾ فَدَعَا
رَبَّهُٓ اَنَّ هٰٓؤُ۬لَٓاءِ قَوْمٌ مُجْرِمُونَ﴿٢٢﴾ فَاَسْرِ بِعِبَاد۪ي لَيْلًا اِنَّكُمْ مُتَّبَعُونَۙ ﴿٢٣﴾ وَاتْرُكِ الْبَحْرَ رَهْوًاۜ اِنَّهُمْ
جُنْدٌ مُغْرَقُونَ ﴿٢٤﴾

---

**18) (اَنْ اَدُّٓوا اِلَيَّ عِبَادَ اللّٰهِۜ اِنّ۪ي لَكُمْ رَسُولٌ اَم۪ينٌ)** (Musa) **qibtiləri dəvət edib dedi: "Allah-Təalanın bəndələri olan Bəni-İsrailə əziyyət etməyib, onları mənə həvalə edin, həqiqətən, mən sizə Allah-Təalanın vəhyini gətirən etibarlı bir peyğəmbərəm.**

**19) (وَاَنْ لَا تَعْلُوا عَلَى اللّٰهِۚ اِنّ۪ٓي اٰت۪يكُمْ بِسُلْطَانٍ مُب۪ينٍۚ) Allah-Təalanın hikmətinə və peyğəmbərinə zillət və həqarət nəzərilə baxmayıb, Allah-Təalaya qarşı təkəbbürlənməyin, həqiqətən, mən sizə peyğəmbər olduğuma işarə edən açıq-aşkar dəlil, sübut gətirdim.** (Elə ki, Musa bu sözləri qibtilərə dedi, onlar cavabında dedilər: ''Səni daşla vurub qətl edərik. O vaxt da Musa onların şərindən Allah-Təalaya pənah apardı. Necə ki, növbəti ayədə buyurur).

**20) (وَاِنّ۪ي عُذْتُ بِرَبّ۪ي وَرَبِّكُمْ اَنْ تَرْجُمُونِۘ ) Ey qibtilər, həqiqətən, sizin məni daşla vurub qətl etmənizdən mənim və sizin rəbbiniz olan Allah-Təalaya pənah aparıram. Allah-Təala məni sizdən mühafizə edər.**

**21) (وَاِنْ لَمْ تُؤْمِنُوا ل۪ي فَاعْتَزِلُونِ) - Əgər mənə iman etmirsinizsə, məndən uzaq olub, daha mənimlə dostluq və əlaqə saxlamayın, çünki mənimlə Allah-Təalaya iman etməyən şəxslərin arasında məhəbbət və yaxınlaşma olmaz.** (Elə ki, Musa qibtilərə hər bir növ dəlil və sübut gətirdi, iman etmədilər. O vaxt onlara bəddua etdi. Necə ki, növbəti ayədə xəbər verir).

**22) (فَدَعَا رَبَّهُٓ اَنَّ هٰٓؤُ۬لَٓاءِ قَوْمٌ مُجْرِمُونَ)** (Musa) **öz rəbbi Allah-Təalaya dua edib dedi: "Ey mənim rəbbim, həqiqətən, bu qibtilər, asi bir camaatdır, onlara əzab göndər.**

**23) (فَاَسْرِ بِعِبَاد۪ي لَيْلًا اِنَّكُمْ مُتَّبَعُونَ)** - (Ey Məhəmməd), **o vaxt Musaya xitab edib dedik: "Ey Musa, gecə vaxtı mənim bəndələrim olan Bəni-İsraili götürüb, Misirdən çıx. Həqiqətən, firon və onun camaatı sizin dalınızca Misirdən çıxıb gələcəklər. Diqqətli olun.**

**24) (وَاتْرُكِ الْبَحْرَ رَهْوًاۜ اِنَّهُمْ جُنْدٌ مُغْرَقُونَ)** - (Ey Musa), **elə ki, dənizdən qurtuldunuz, dənizi həmin yarılmış halda qoy qalsın, daha bizdən onun birləşməsini istəmə. Həqiqətən, fironun qoşunu elə bir qoşundur ki, bizim tərəfimizdən onların** (suda) **qərq olmasına hökm verilibdir. Gərək dənizdə qərq olub həlak olsunlar.**

كَمْ تَرَكُوا مِنْ جَنَّاتٍ وَعُيُونٍۙ ﴿٢٥﴾ وَزُرُوعٍ وَمَقَامٍ كَرِيمٍۙ ﴿٢٦﴾ وَنَعْمَةٍ كَانُوا فِيهَا فَاكِهِينَۙ ﴿٢٧﴾
كَذٰلِكَ۠ وَاَوْرَثْنَاهَا قَوْمًا اٰخَرِينَ ﴿٢٨﴾ فَمَا بَكَتْ عَلَيْهِمُ السَّمَآءُ وَالْاَرْضُ وَمَا كَانُوا مُنْظَرِينَ۟ ﴿٢٩﴾
وَلَقَدْ نَجَّيْنَا بَنِي اِسْرَآءِيلَ مِنَ الْعَذَابِ الْمُهِينِۙ﴿٣٠﴾ مِنْ فِرْعَوْنَۜ اِنَّهُ كَانَ عَالِيًا مِنَ الْمُسْرِفِينَ﴿٣١﴾
وَلَقَدِ اخْتَرْنَاهُمْ عَلٰى عِلْمٍ عَلَى الْعَالَمِينَ۟ ﴿٣٢﴾ وَاٰتَيْنَاهُمْ مِنَ الْاٰيَاتِ مَا فِيهِ بَلٰٓؤٌا مُبِينٌ ﴿٣٣﴾

---

**25)** (كَمْ تَرَكُوا مِنْ جَنَّاتٍ وَعُيُونٍۙ) - (Ey Məhəmməd), **fironun xalqı həlak olub, nə çox gözəl bağlar və şirin sulu çeşmələr qoyub getdilər.**

**26)** (وَزُرُوعٍ وَمَقَامٍ كَرِيمٍ) **Və nə çox növbənöv əkinlər və şərəfli gözəl məclislər özlərindən sonra qoydular.**

**27)** (وَنَعْمَةٍ كَانُوا فِيهَا فَاكِهِينَ) **Və nə çox ləzzət verən şeylər ki, onlardan ləzzət alıb, fərəh və sevinclə güzəran sürürdülər. Hamısını tərk edib getdilər.**

**28)** (كَذٰلِكَ۠ وَاَوْرَثْنَاهَا قَوْمًا اٰخَرِينَ) (Ey Məhəmməd), **necə ki, bəhs olundu,** (qibtiləri) **Misirdən çıxarib, həmin fəxr etdikləri Misiri başqa bir camaata miras verdik, hansı ki, nə özləri, nə də dinləri onlardan deyildi.**

**29)** (فَمَا بَكَتْ عَلَيْهِمُ السَّمَآءُ وَالْاَرْضُ وَمَا كَانُوا مُنْظَرِينَ) - (Ey Məhəmməd), **Allah-Təala qibtiləri o əzəmət və qüdrətləri ilə həlak etdi. Nə göy, nə də yer onlar üçün ah-nalə edib, ağlamadı və əzab vaxtında da onlara möhlət verilmədi. Hamısı həlak olub məhv oldular. Təkəbbür, qürur və qüdrət onlara heç bir fayda vermədi.**

**30)** (وَلَقَدْ نَجَّيْنَا بَنِي اِسْرَآءِيلَ مِنَ الْعَذَابِ الْمُهِينِۙ) - (Ey Məhəmməd), **həqiqətən, Bəni-İsrailə zəlil və rəzil edən əzabdan nicat verdik, hansı ki, onların oğlan uşaqlarını qətl edib, kişilərini hər bir məşəqqətli əməllərə vadar edirdilər.**

**31)** (مِنْ فِرْعَوْنَۜ اِنَّهُ كَانَ عَالِيًا مِنَ الْمُسْرِفِينَ) **- Bəni-İsrailə fironun əzabından nicat verdik. Həqiqətən, firon təkəbbürlü, məğrur və həddini aşan şəxslərdən idi.**

**32)** (وَلَقَدِ اخْتَرْنَاهُمْ عَلٰى عِلْمٍ عَلَى الْعَالَمِينَ) - (Ey Məhəmməd), **həqiqətən, Bəni-İsrailə elm** (Tövrat) **verib, öz aləmlərində olan məxluqata onları üstün etdik.**

**33)** (وَاٰتَيْنَاهُمْ مِنَ الْاٰيَاتِ مَا فِيهِ بَلٰٓؤٌا مُبِينٌ) - (Ey Məhəmməd), **bizim tövhid və qüdrətimizə işarə edən dəlil və sübutlardan Bəni-İsrailə verdik, hansı ki, o dəlil və sübutlarda onları açıq-aşkar imtahan etmək var idi. Bəs o dəlillərə tabe olub, bizim tövhidimizi və qiyaməti iqrar etməyə davam etdilərmi? Əksinə hamısı asi oldular.**

اِنَّ هٰۤؤُلَۤاءِ لَيَقُولُونَ ۙ ﴿٣٤﴾ اِنْ هِيَ اِلَّا مَوْتَتُنَا الْاُولٰى وَمَا نَحْنُ بِمُنْشَرِينَ ﴿٣٥﴾ فَأْتُوا بِاٰبَٓائِنَٓا اِنْ كُنْتُمْ صَادِقِينَ ﴿٣٦﴾ اَهُمْ خَيْرٌ اَمْ قَوْمُ تُبَّعٍ ۙ وَالَّذِينَ مِنْ قَبْلِهِمْ ۜ اَهْلَكْنَاهُمْ ۘ اِنَّهُمْ كَانُوا مُجْرِمِينَ﴿٣٧﴾ وَمَا خَلَقْنَا السَّمٰوَاتِ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَا لَاعِبِينَ ﴿٣٨﴾ مَا خَلَقْنَاهُمَٓا اِلَّا بِالْحَقِّ وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَعْلَمُونَ ﴿٣٩﴾

---

**34-35) (اِنَّ هٰۤؤُلَۤاءِ لَيَقُولُونَ ۙ اِنْ هِيَ اِلَّا مَوْتَتُنَا الْاُولٰى وَمَا نَحْنُ بِمُنْشَرِينَ ) -** (Ey Məhəmməd), **həqiqətən, bu müşriklər də qiyaməti inkar edib deyirlər: “Bizdən ötrü ölümdən sonra dirilmək, haqq-hesab, heç bir şey yoxdur. Ancaq bir dəfə və ilk dəfə ölərik, daha ondan sonra bizdən ötrü yenidən dirilmək mümkün olmayacaqdır.**

**36) (فَأْتُوا بِاٰبَٓائِنَٓا اِنْ كُنْتُمْ صَادِقِينَ) -** (Müşriklər deyirlər: “Ey Məhəmməd və möminlər), **siz ki, deyirsiniz, yenidən dirilib, məhşərə varid olmaq haqdır, əgər bu sözünüzdə doğrusunuzsa, bizim keçmiş ata-babalarımızı dirildib gətirin ki, onlardan xəbər alaq, görək qiyamət vaqe olacaq, ya nə?** (Müşriklər çox vaxt peyğəmbərin ulu babası olan Qusay ibn Kilabın dirilməsini istəyirdilər ki, ona daha çox inandıqları üçün qiyamətin həqiqətini ondan xəbər alsınlar).

**37) (اَهُمْ خَيْرٌ اَمْ قَوْمُ تُبَّعٍ ۙ وَالَّذِينَ مِنْ قَبْلِهِمْ) - Görəsən, şücaət və hünərdə məkkəli Qüreyş camaatı yaxşı və üstündür, yoxsa Tübbə* və onlardan əvvəlki camaatlar? (اَهْلَكْنَاهُمْ ۘ اِنَّهُمْ كَانُوا مُجْرِمِينَ) - Onlar bu Qüreyş camaatından daha hünərli və şücaətli olduqları halda, hamısını həlak etdik. Həqiqətən, onlar asi və günahkar olan camaatdırlar. Necə ki, onları həlak etdik, bu Qüreyş camaatını da həlak etməyə qadirik.**

**(*Qeyd:** Tübbə Allah Rəsulundan əvvəl Yəməndə padşah idi, (Yəmən padşahlarına Tübbə deyilirdi), müşrik və bütpərəst idi. Ondan sonra yəhudi dinini seçdi. Xalqını yəhudiliyə dəvət etsə də, onlar qəbul etmədilər. Küfr və günahda israr etdilər. Həmin Tübbənin adı Əsəd İbn Məlik, ləqəbi Əbu Kərb idi. Ərəbistanda Hirə şəhərini, şərqdə Səmərqəndi tikdirdi. Yer kürəsinin əksər hissəsinə sahib olub, qüdrətli bir sultan idi. Kəbəyə ilk örtü saldıran həmin sultan idi. Yəmən parçasından Kəbəyə örtü taxdı. Ondan sonra həmin gözəl adət günümüzə qədər davam etdi).

**38) (وَمَا خَلَقْنَا السَّمٰوَاتِ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَا لَاعِبِينَ) -** (Ey Məhəmməd), **göyləri, yeri və onların arasında olan hər bir növ məxluqu oyun və əyləncə üçün, boş yerə yaratmamışıq.**

**39) (مَا خَلَقْنَاهُمَٓا اِلَّا بِالْحَقِّ وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَعْلَمُونَ) - Əksinə, onları haqq və hikmət üzrə yaratmışıq. Gərək onlara baxıb, ibrət alıb, müvəhhid olsunlar. Lakin insanların əksəriyyəti cəhalətdə qalıb, onların hikmət üzrə yaradılmasına agah olmayıb, müşrik və bütpərəst olub, iman etmirlər.**

إِنَّ يَوْمَ الْفَصْلِ مِيقَاتُهُمْ اَجْمَعِينَۙ ﴿٤٠﴾ يَوْمَ لَا يُغْنِي مَوْلًى عَنْ مَوْلًى شَيْـًٔا وَلَا هُمْ يُنْصَرُونَۙ ﴿٤١﴾
اِلَّا مَنْ رَحِمَ اللّٰهُۜ اِنَّهُ هُوَ الْعَزِيزُ الرَّحِيمُ ﴿٤٢﴾ اِنَّ شَجَرَتَ الزَّقُّومِۙ ﴿٤٣﴾ طَعَامُ الْاَثِيمِۚ ﴿٤٤﴾
كَالْمُهْلِۚ يَغْلِي فِي الْبُطُونِۙ ﴿٤٥﴾ كَغَلْيِ الْحَمِيمِ ﴿٤٦﴾ خُذُوهُ فَاعْتِلُوهُ اِلٰى سَوَٓاءِ الْجَحِيمِۗ ﴿٤٧﴾
ثُمَّ صُبُّوا فَوْقَ رَاْسِهِ مِنْ عَذَابِ الْحَمِيمِ ﴿٤٨﴾ ذُقْ اِنَّكَ اَنْتَ الْعَزِيزُ الْكَرِيمُ ﴿٤٩﴾

---

**40) (اِنَّ يَوْمَ الْفَصْلِ مِيقَاتُهُمْ اَجْمَعِينَ) - Həqiqətən, haqq, batil, yaxşı, pis bir-birindən aralanan gün** (qiyamət günü) **bütün məxluqlar üçün təyin edilmiş vaxtdır. O gün hamısı cəm olub, zalımdan məzlumun intiqamı alınacaqdır.**

**41) (يَوْمَ لَا يُغْنِي مَوْلًى عَنْ مَوْلًى شَيْـًٔا وَلَا هُمْ يُنْصَرُونَ) - Qiyamət günü elə bir gündür ki, heç bir dost və qohum öz dostu və qohumundan bir bəlanı dəf edib, onu Allah-Təaladan ehtiyacsız edə bilməz və onlara kömək də edilməyib, Allah-Təalanın əzabını onlardan dəf edən olmaz.**

**42) (اِلَّا مَنْ رَحِمَ اللّٰهُۜ اِنَّهُ هُوَ الْعَزِيزُ الرَّحِيمُ) - Qiyamət günündə Allah-Təalanın xeyir əməlinə görə rəhm edib, əzabdan nicat verdiyi şəxsdən başqasına kömək edilməz. Həqiqətən, Allah-Təala məxluqatına qalibdir, itaət edənlərə rəhm edib onları bağışlayandır.**

**43-44) (اِنَّ شَجَرَتَ الزَّقُّومِۙ طَعَامُ الْاَثِيمِۚ)** - (Ey Məhəmməd), **həqiqətən, cəhənnəmdə fasiqin, günahkarın yeməyi* zəqqum ağacının meyvəsidir ki, son dərəcə acıdır.**

**(*Qeyd:** zəqqum ağacı Ərəbistanda meyvəsi öldürücü zəhərli olan acı bir şeydir. Allah-Təala cəhənnəm əhlinin yeməyinin necə iyrənc və acı olmasını bizə anlatmaqdan ötrü onu zəqqum adlandırır ki, dünyəvi misallarla axirətə agah olaq).

**45-46) (كَالْمُهْلِۚ يَغْلِي فِي الْبُطُونِۙ كَغَلْيِ الْحَمِيمِ) - Zəqqum ağacının meyvəsi onların qarnında zeytun yağının xıltı kimi olub, isti su qaynayan kimi qaynayar.**

**47) (خُذُوهُ فَاعْتِلُوهُ اِلٰى سَوَٓاءِ الْجَحِيمِۗ)** - (Ey Məhəmməd), **cəhənnəmin mühafizlərinə əmr edərik, o fasiq və günahkarı tutub, cəhənnəmin ortasına atın.**

**48) (ثُمَّ صُبُّوا فَوْقَ رَاْسِهِ مِنْ عَذَابِ الْحَمِيمِ) - Cəhənnəmin ortasına aparandan sonra başının üstünə cəhənnəmin isti suyundan tökməklə ona əzab edin.**

**49) (ذُقْ اِنَّكَ اَنْتَ الْعَزِيزُ الْكَرِيمُ) - Ondan sonra ona deyin, həqiqətən, sən dünyada xalqın arasında hər bir nemətə sahib olub əziz və hörmətli idin. O nemətlərə görə, məğrur olub, aldanıb, Allah-Təalaya asi oldun. Asi olduğun üçün bu əzabı dad.**

اِنَّ هٰذَا مَا كُنْتُمْ بِهٖ تَمْتَرُونَ ﴿٥٠﴾ اِنَّ الْمُتَّقِينَ فٖي مَقَامٍ اَمٖينٍۙ ﴿٥١﴾ فٖي جَنَّاتٍ وَعُيُونٍۚ ﴿٥٢﴾
يَلْبَسُونَ مِنْ سُنْدُسٍ وَاِسْتَبْرَقٍ مُتَقَابِلٖينَۚ ﴿٥٣﴾ كَذٰلِكَ وَزَوَّجْنَاهُمْ بِحُورٍ عٖينٍۜ ﴿٥٤﴾ يَدْعُونَ
فٖيهَا بِكُلِّ فَاكِهَةٍ اٰمِنٖينَۙ ﴿٥٥﴾ لَا يَذُوقُونَ فٖيهَا الْمَوْتَ اِلَّا الْمَوْتَةَ الْاُولٰىۚ وَوَقٰيهُمْ عَذَابَ الْجَحٖيمِۙ
﴿٥٦﴾ فَضْلًا مِنْ رَبِّكَۜ ذٰلِكَ هُوَ الْفَوْزُ الْعَظٖيمُ ﴿٥٧﴾ فَاِنَّمَا يَسَّرْنَاهُ بِلِسَانِكَ لَعَلَّهُمْ يَتَذَكَّرُونَ
﴿٥٨﴾ فَارْتَقِبْ اِنَّهُمْ مُرْتَقِبُونَ ﴿٥٩﴾

---

**50) (اِنَّ هٰذَا مَا كُنْتُمْ بِهٖ تَمْتَرُونَ) - Həqiqətən, bu həmin əzabdır ki, şəkk edib onu qəbul etmirdiniz, indi onun haqq olması sizə məlum oldumu?**

**51) (اِنَّ الْمُتَّقٖينَ فٖي مَقَامٍ اَمٖينٍۙ)** - (Ey Məhəmməd), **həqiqətən, müttəqilər axirətdə hər bir əzab və çirkin işlərdən xatircəm olub, heç bir qəm və qüssə onlara yetişməz.**

**52) (فٖي جَنَّاتٍ وَعُيُونٍۚ) - Onlar gözəl cənnətlərdə olub, o cənnətlərdə çeşmələr axar.**

**53) (يَلْبَسُونَ مِنْ سُنْدُسٍ وَاِسْتَبْرَقٍ مُتَقَابِلٖينَ) - Dünyadakı kimi nazik və qalın libaslar geyib, məclislərində üzbəüz əyləşib,** (necə ki, dostlar əyləşirlər) **söhbətlə məşğul olarlar.**

**54) (كَذٰلِكَ وَزَوَّجْنَاهُمْ بِحُورٍ عٖينٍۜ) - Müttəqilərə hər bir növ neməti verdiyimiz kimi onlara iri gözlü huriləri verdik ki, axirətdə onlarla evlənəcəklər.**

**55) (يَدْعُونَ فٖيهَا بِكُلِّ فَاكِهَةٍ اٰمِنٖينَ) Yemək-içməyin zərərindən amanda olduqları halda həmin cənnətdə hansı meyvədən istəsələr, o meyvə onlardan ötrü mövcud olar.**

**56) (لَا يَذُوقُونَ فٖيهَا الْمَوْتَ اِلَّا الْمَوْتَةَ الْاُولٰىۚ وَوَقٰيهُمْ عَذَابَ الْجَحٖيمِۙ) - Cənnətdə ölüm onlara gəlməyib, dünyada daddıqları ilk ölüm acısını orada dadmazlar və Allah-Təala onları cəhənnəm əzabından mühafizə edər.**

**57) (فَضْلًا مِنْ رَبِّكَۜ ذٰلِكَ هُوَ الْفَوْزُ الْعَظٖيمُ) - (Ey Məhəmməd), müttəqilərə bəxş olunan nemətlərin hamısı sənin rəbbin Allah-Təalanın mərhəmətindəndir. Böyük əcr və savaba yetişmək budur.**

**58) (فَاِنَّمَا يَسَّرْنَاهُ بِلِسَانِكَ لَعَلَّهُمْ يَتَذَكَّرُونَ)** - (Ey Məhəmməd), **Qurani-Şərifin ehkamını xalqa yetir, həqiqətən, biz bu Quranı sən ümmi olduğun halda, sənin dilin üçün asan etdik ki, onun uca məzmununu xalqa çatdırasan. Bəlkə agah olub, nəsihəti qəbul edib, iman edib müvəhhid oldular.**

**59) (فَارْتَقِبْ اِنَّهُمْ مُرْتَقِبُونَ)** - (Ey Məhəmməd), **həqiqətən, müşriklər gözləyirlər ki, sənə bir bəla yetişib, səndən qurtulsunlar. Sən də onlara yetişən bəlanı gözlə ki, Allah-Təala onlara bəla göndərib, sənin əlində necə zəlil olacaqlar.**

## *Duxan surəsi*

**Allaha həmd olsun, Duxan surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurubdur: “Kim ki, Duxan surəsini cümə gecəsi oxusa, o gecə bağışlandığı halda, sabaha çıxar”.**

## əl-CASİYƏ SURƏSİ

45-ci surədir. Məkkədə nazil olub, 37 ayə, 477 kəlmə və 2191 hərfdir.

حمٓ ﴿١﴾ تَنْزِيلُ الْكِتَابِ مِنَ اللّٰهِ الْعَزِيزِ الْحَكِيمِ ﴿٢﴾ اِنَّ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ لَاٰيَاتٍ لِلْمُؤْمِنِينَ
﴿٣﴾ وَفِي خَلْقِكُمْ وَمَا يَبُثُّ مِنْ دَآبَّةٍ اٰيَاتٌ لِقَوْمٍ يُوقِنُونَ ﴿٤﴾ وَاخْتِلَافِ الَّيْلِ وَالنَّهَارِ وَمَآ اَنْزَلَ اللّٰهُ
مِنَ السَّمَآءِ مِنْ رِزْقٍ فَاَحْيَا بِهِ الْاَرْضَ بَعْدَ مَوْتِهَا وَتَصْرِيفِ الرِّيَاحِ اٰيَاتٌ لِقَوْمٍ يَعْقِلُونَ ﴿٥﴾ تِلْكَ
اٰيَاتُ اللّٰهِ نَتْلُوهَا عَلَيْكَ بِالْحَقِّ فَبِاَيِّ حَدِيثٍ بَعْدَ اللّٰهِ وَاٰيَاتِهِ يُؤْمِنُونَ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (حمٓ) - Bu mübarək surənin adıdır.**

**2) (تَنْزِيلُ الْكِتَابِ مِنَ اللّٰهِ الْعَزِيزِ الْحَكِيمِ) - Bu kitabın** (Quranın) **nazil olması məxluqata qalib olub, hər bir feili hikmət üzrə olan Allah-Təala tərəfindəndir.**

**3) (اِنَّ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ لَاٰيَاتٍ لِلْمُؤْمِنِينَ) Həqiqətən, göylərdə və yerdə möminlərdən ötrü Allah-Təalanın tövhid və qüdrətinə işarə edən dəlil və sübutlar vardır.**

**4) (وَفِي خَلْقِكُمْ وَمَا يَبُثُّ مِنْ دَآبَّةٍ اٰيَاتٌ لِقَوْمٍ يُوقِنُونَ) Və yenə siz insanların yaradılmasında və yer üzündə Allah-Təalanın yaydığı hər bir növ heyvanatda Allah-Təalanın tövhid və qüdrətinə tam inananlardan ötrü dəlil və sübutlar vardır.**

**5) (وَاخْتِلَافِ الَّيْلِ وَالنَّهَارِ) - Gecə və gündüzün müxtəlif olmasında** (gah uzun, gah qısa, gah işıqlı, gah qaranlıq olmasında),

**(وَمَآ اَنْزَلَ اللّٰهُ مِنَ السَّمَآءِ مِنْ رِزْقٍ فَاَحْيَا بِهِ الْاَرْضَ بَعْدَ مَوْتِهَا ) - və Allah-Təalanın göydən ruzi səbəbi olaraq göndərdiyi o sular ki, yer öləndən sonra o suyun səbəbinə dirildib, hər bir növ nemətləri yerdən çıxarır, (وَتَصْرِيفِ الرِّيَاحِ) - küləkləri dolandırıb** (gah şimal, gah cənub, gah qərb küləyi, gah şərqdən əsən xoş səba yeli) **müxtəlif cəhətlərə əsdirməkdə (اٰيَاتٌ لِقَوْمٍ يَعْقِلُونَ) - ağıllı və kamil elm sahibi şəxslərdən ötrü Allah-Təalanın tövhid və qüdrətinə dəlil və sübutlar vardır.**

**6) (تِلْكَ اٰيَاتُ اللّٰهِ نَتْلُوهَا عَلَيْكَ بِالْحَقِّ فَبِاَيِّ حَدِيثٍ بَعْدَ اللّٰهِ وَاٰيَاتِهِ يُؤْمِنُونَ) -** (Ey Məhəmməd), **bu bəhs olunan dəlillər sənin rəbbin Allah-Təalanın dəlil və sübutlarıdır ki, sənə haqq və hikmət üzrə onları oxuyuruq. Allah-Təalanın* bu ayəsini eşidəndən sonra bunları qoyub, hansı sözə iman edəcəklər? Belə haqq və hikmətamiz sözlərə iman etməyəndən sonra boş və batil sözlərə iman edəcəklər?** (Necə ki edirlər).

وَيْلٌ لِكُلِّ اَفَّاكٍ اَثِيمٍۙ ﴿٧﴾ يَسْمَعُ اٰيَاتِ اللّٰهِ تُتْلٰى عَلَيْهِ ثُمَّ يُصِرُّ مُسْتَكْبِرًا كَاَنْ لَمْ يَسْمَعْهَاۚ فَبَشِّرْهُ
بِعَذَابٍ اَلِيمٍ﴿٨﴾ وَاِذَا عَلِمَ مِنْ اٰيَاتِنَا شَيْـًٔا اتَّخَذَهَا هُزُوًاؕ اُو۬لٰٓئِكَ لَهُمْ عَذَابٌ مُهِينٌؕ ﴿٩﴾ مِنْ
وَرَآئِهِمْ جَهَنَّمُۚ

---

**(*Qeyd:** *"İlahi, sən özün agahsan ki, adlarını Quran əhli qoyanlar Quranın haqq və hikmətli sözlərini tərk edib yalan, boş sözlərə iman edib, onları özlərinə din və ayin seçiblər. Qurani-Şərifin açıq-aydın ayələrini "xəbəri-vahid"lə, hətta uydurma xəbərlərlə məhdudlaşdırıb, hökmsüz ediblər. Əgər belə deyil isə, bəs islam ümmətinin arasındakı bu ixtilaf nədir və haradan peyda olubdur? Həmin ayə ilə Allah-Təala bizim halətimizə işarə edib, bizi qəflət yuxusundan oyandırır. Amma islam ümmətinin rəisləri bizi qəflət yuxusuna elə salmayıblar ki, Qurani-Şərifin işarələrini anlayıb, agah olaq və qəflət və cəhalətdən qurtulub, düz adam olaq. Qəlblərimiz cəhalətdən elə paslanıb ki,*

*Qurani-Şərifin nəinki rəmz və incəliklərini, hətta açıq, aydın ayələrini də anlamırıq. Lakin günah əməllərimizə rəvac vermək üçün onları gizlədib üstünə də pərdə çəkirik. Vay olsun bizə, islama əcəb şeylər əlavə edib, özümüzdən qanun və hökmlər çıxartmışıq. Diqqətlə baxıb, Qurani-Şərifin uca məzmununu dərk edib, bizim əməllərimizi ölçəndə, bizim zəlalətimiz meydana çıxır. Nə gözəl demişlər: farsca ifadə Həqiqətən də, belədir, biz müsəlmanların arasında hənif dini olan islamın əsl qayda-qanunlarından heç bir şey qalmayıbdır. Əksinə, adlarını rəis qoyanlar Allahın kitabının əvəzində zənnə, gümana tabe olub, islamın gözəl qanunlarını bərbad edib, onların əvəzinə nəfsani istəklərinə uyğun bidətlər yaradıblar. Hərçənd bu sözlər riyakarlara zəqqum meyvəsinin dadını verəcəkdir. Lakin məna əhli üçün onun şirinliyi həyat sürdükcə davam edəcəkdir. Müvəffəq edən Allahdır).*

**7-8) (وَيْلٌ لِكُلِّ اَفَّاكٍ اَثِيمٍۙ) - Hər bir yalançı fasiq və günahkara əzab olsun. (يَسْمَعُ اٰيَاتِ اللّٰهِ تُتْلٰى عَلَيْهِ ثُمَّ يُصِرُّ مُسْتَكْبِرًا كَاَنْ لَمْ يَسْمَعْهَاۚ) - Yalançı və fasiq Allah-Təalanın ayələri oxunduğunu eşidər. Eşidəndən sonra təkəbbür və qürur səbəbi ilə o ayələrə iman etməyib, küfründə israr edib qalar. Guya o açıq-aydın ayələri əsla eşitməyibdir. (فَبَشِّرْهُ بِعَذَابٍ اَلِيمٍ)** - (Ey Məhəmməd), **belə şəxsi əziyyət verən əzabla müjdələ.**

**9) (وَاِذَا عَلِمَ مِنْ اٰيَاتِنَا شَيْـًٔا اتَّخَذَهَا هُزُوًا) - Yalançı və fasiq şəxs nə zaman ki, bizim ayələrimizdən bir şeyə agah oldu,** (yəni sən ey Məhəmməd, bizim ayələrimizi ona çatdırdın), **o vaxt da bizim ayələrimizə istehza edib əylənər. (اُو۬لٰٓئِكَ لَهُمْ عَذَابٌ مُهِينٌ) - Belə şəxslərdən ötrü** (dünyada) **onları zəlil edən əzab vardır.** (Necə ki, Qüreyş tayfasına Bədir savaşında əzab edildi).

**10) (مِنْ وَرَآئِهِمْ جَهَنَّمُ) - Dünyadan köçəndən sonra qarşılarında cəhənnəm əzabı onlardan ötrü hazırdır.**

وَلَا يُغْنِي عَنْهُمْ مَا كَسَبُوا شَيْئًا وَلَا مَا اتَّخَذُوا مِنْ دُونِ اللّٰهِ اَوْلِيَٓاءَۚ وَلَهُمْ عَذَابٌ عَظِيمٌۜ ﴿١٠﴾ هٰذَا
هُدًىۚ وَالَّذِينَ كَفَرُوا بِاٰيَاتِ رَبِّهِمْ لَهُمْ عَذَابٌ مِنْ رِجْزٍ اَلِيمٌ ﴿١١﴾ اَللّٰهُ الَّذِي سَخَّرَ لَكُمُ الْبَحْرَ
لِتَجْرِيَ الْفُلْكُ فِيهِ بِاَمْرِهِ وَلِتَبْتَغُوا مِنْ فَضْلِهِ وَلَعَلَّكُمْ تَشْكُرُونَۚ ﴿١٢﴾ وَسَخَّرَ لَكُمْ مَا فِي السَّمٰوَاتِ
وَمَا فِي الْاَرْضِ جَمِيعًا مِنْهُۜ اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَتَفَكَّرُونَ ﴿١٣﴾ قُلْ لِلَّذِينَ اٰمَنُوا يَغْفِرُوا
لِلَّذِينَ لَا يَرْجُونَ اَيَّامَ اللّٰهِ لِيَجْزِيَ قَوْمًا بِمَا كَانُوا يَكْسِبُونَ ﴿١٤﴾ مَنْ عَمِلَ صَالِحًا فَلِنَفْسِهِۚ وَمَنْ
اَسَٓاءَ فَعَلَيْهَاۜ ثُمَّ اِلٰى رَبِّكُمْ تُرْجَعُونَ ﴿١٥﴾

---

(وَلَا يُغْنِي عَنْهُمْ مَا كَسَبُوا شَيْئًا وَلَا مَا اتَّخَذُوا مِنْ دُونِ اللّٰهِ اَوْلِيَٓاءَ) **- Müşriklərin qazandıqları malları və Allah-Təaladan başqa özlərinə məbud seçib sitayiş etdikləri bütləri onlara heç bir fayda verməyib, onları Allah-Təaladan ehtiyacsız etməz.** (وَلَهُمْ عَذَابٌ عَظِيمٌ) **- Onlardan ötrü böyük əzab vardır.**

**11)** (هٰذَا هُدًىۚ وَالَّذِينَ كَفَرُوا بِاٰيَاتِ رَبِّهِمْ لَهُمْ عَذَابٌ مِنْ رِجْزٍ اَلِيمٌ) **- Bu Quran haqq tərəfinə hidayət etməkdə kamil bir kitabdır. O şəxslər ki, rəbləri Allah-Təalanın ayələrinə** (Qurana) **kafir olub hidayətə gəlmirlər, onlardan ötrü şiddətli əziyyət verən əzab vardır.**

**12)** (اَللّٰهُ الَّذِي سَخَّرَ لَكُمُ الْبَحْرَ لِتَجْرِيَ الْفُلْكُ فِيهِ بِاَمْرِهِ وَلِتَبْتَغُوا مِنْ فَضْلِهِ وَلَعَلَّكُمْ تَشْكُرُونَ) **-Allah-Təala öz kamil qüdrəti ilə dənizi sizə tabe etdi ki, onun əmri ilə dənizdə gəmilər üzüb sizi arzunuza çatdırsınlar. Dənizdə gəmilərin səbəbi ilə səfər edib, Allah-Təalanın lütf və rəhmətini istəyib, ruzi əldə edəsiniz və əlbəttə, gərək Allah-Təalanın bu nemətlərinə şükür edəsiniz.**

**13)** (وَسَخَّرَ لَكُمْ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ جَمِيعًا مِنْهُ) **- Allah-Təala öz kamil qüdrəti ilə göylərdə və yerdə olan hər bir şeyi siz insanların ehtiyacını dəf etməkdən ötrü yaradıb və onları sizə tabe edibdir. O şeylər hamısı Allah-Təaladandır və o şeyləri hikmət üzrə yaradan yeganə Allah-Təaladır.**

(اِنَّ فِي ذٰلِكَ لَاٰيَاتٍ لِقَوْمٍ يَتَفَكَّرُونَ) **- Həqiqətən, bu bəhs olunan şeylərdə Allah-Təalanın qüdrət və tövhidinə fikir verib həqiqəti dərk edən camaat üçün dəlil və sübutlar vardır.**

**14)** (قُلْ لِلَّذِينَ اٰمَنُوا يَغْفِرُوا لِلَّذِينَ لَا يَرْجُونَ اَيَّامَ اللّٰهِ) - (Ey Məhəmməd), **möminlərə de ki, o şəxslər ki, Allah-Təalanın vədinə ümidvar olmayıb, Allah-Təalaya asi olurlar və sizə əziyyət və əzab edirlər, onları bağışlasınlar, onların pisliyinə pisliklə qarşılıq verməsinlər. Onları Allah-Təalaya həvalə etsinlər.** (لِيَجْزِيَ قَوْمًا بِمَا كَانُوا يَكْسِبُونَ) **- Belə ki, Allah-Təala həmin möminlərə qazandıqları xeyir əməllərin mükafatını verib, düşmənlərini zəlil etsin.**

**15)** (مَنْ عَمِلَ صَالِحًا فَلِنَفْسِهِۚ) - (Ey Məhəmməd), **kim xeyir əməl etsə, onun mükafatı o şəxsin öz mənfəətinə olar.** (وَمَنْ اَسَٓاءَ فَعَلَيْهَاۜ ثُمَّ اِلٰى رَبِّكُمْ تُرْجَعُونَ) **- Və**

وَلَقَدْ اٰتَيْنَا بَنٖٓي اِسْرَٓاءٖيلَ الْكِتَابَ وَالْحُكْمَ وَالنُّبُوَّةَ وَرَزَقْنَاهُمْ مِنَ الطَّيِّبَاتِ وَفَضَّلْنَاهُمْ عَلَى الْعَالَمٖينَ
﴿١٦﴾ وَاٰتَيْنَاهُمْ بَيِّنَاتٍ مِنَ الْاَمْرِۚ فَمَا اخْتَلَفُوٓا اِلَّا مِنْ بَعْدِ مَا جَٓاءَهُمُ الْعِلْمُۙ بَغْيًا بَيْنَهُمْۜ اِنَّ رَبَّكَ
يَقْضٖي بَيْنَهُمْ يَوْمَ الْقِيٰمَةِ فٖيمَا كَانُوا فٖيهِ يَخْتَلِفُونَ﴿١٧﴾ ثُمَّ جَعَلْنَاكَ عَلٰى شَرٖيعَةٍ مِنَ الْاَمْرِ فَاتَّبِعْهَا
وَلَا تَتَّبِعْ اَهْوَٓاءَ الَّذٖينَ لَا يَعْلَمُونَ﴿١٨﴾ اِنَّهُمْ لَنْ يُغْنُوا عَنْكَ مِنَ اللّٰهِ شَيْـًٔاۜ وَاِنَّ الظَّالِمٖينَ بَعْضُهُمْ
اَوْلِيَٓاءُ بَعْضٍۚ وَاللّٰهُ وَلِيُّ الْمُتَّقٖينَ ﴿١٩﴾

---

**kim ki, pis və xəbis əməl etsə, o əməlin cəzası o şəxsin öz zərərinə olar. O əməllərdən sonra ölüm sizə gəlib, rəbbiniz Allah-Təalanın tərəfinə qayıdacaqsınız. O vaxt hər bir şəxsə əməlinin qarşılığı veriləcəkdir.**

**16) (وَلَقَدْ اٰتَيْنَا بَنٖٓي اِسْرَٓاءٖيلَ الْكِتَابَ وَالْحُكْمَ وَالنُّبُوَّةَ)** - (Ey Məhəmməd), **həqiqətən, səndən əvvəl Bəni-İsrailə kitab** (Tövrat) **verib, xalqın arasında hökm etməyin elmini və yolunu və peyğəmbərliyi onlara bəxş etdik.** (Musanı və ondan başqa peyğəmbərləri onlara göndərdik).

**(وَرَزَقْنَاهُمْ مِنَ الطَّيِّبَاتِ وَفَضَّلْنَاهُمْ عَلَى الْعَالَمٖينَ) - Halal və nəfsin diksinmədiyi ruzilərdən onlara verdik və öz aləmlərində olan insan nəslinə onları üstün edib, hamısından əziz və hörmətli etdik.**

**17) (وَاٰتَيْنَاهُمْ بَيِّنَاتٍ مِنَ الْاَمْرِۚ) - Din işlərində onlara dəlil və sübutlar verdik ki, din işləri dəlil üzrə sabit olsun. (فَمَا اخْتَلَفُوٓا اِلَّا مِنْ بَعْدِ مَا جَٓاءَهُمُ الْعِلْمُۙ بَغْيًا بَيْنَهُمْ) - Bir camaat və bir millətin arasında elm zühur edib yayılanda, gərək hər bir ixtilaf onların arasından dəf olub götürülsün. Lakin Bəni-İsrailin işi əksinə oldu. Elm** (Tövrat) **onlara gələndən sonra həsəd və ədavətdən dini məsələlərdə ixtilaf edib, alim və rəisləri hər biri özündən bir bidət çıxarıb, xalq arasında yaydılar. (اِنَّ رَبَّكَ يَقْضٖي بَيْنَهُمْ يَوْمَ الْقِيٰمَةِ فٖيمَا كَانُوا فٖيهِ يَخْتَلِفُونَ)** - (Ey Məhəmməd), **həqiqətən, sənin rəbbin Allah-Təala qiyamət günündə onların arasında ixtilaf etdikləri işlərdə hökm edəcəkdir.**

**18) (ثُمَّ جَعَلْنَاكَ عَلٰى شَرٖيعَةٍ مِنَ الْاَمْرِ فَاتَّبِعْهَا وَلَا تَتَّبِعْ اَهْوَٓاءَ الَّذٖينَ لَا يَعْلَمُونَ)** - (Ey Məhəmməd), **Musa öz ümmətinə şəriət verib, sonra onlar ixtilaf edəndən sonra səni dində başqa bir şəriət və yol üzrə seçib, həmin şəriət barəsində sənə** (Quranı) **nazil etdik. Həmin şəriətə** (Qurana) **tabe olub, cahil və nadan şəxslərin istəyi ilə yaranan dinə tabe olma.**

**19) (اِنَّهُمْ لَنْ يُغْنُوا عَنْكَ مِنَ اللّٰهِ شَيْـًٔاۜ) Həqiqətən, cahil və nadanlar, heç bir şey səni Allah-Təaladan ehtiyacsız edə bilməz, hər bir əmrdə sənin ehtiyacın Allah-Təalayadır. (وَاِنَّ الظَّالِمٖينَ بَعْضُهُمْ اَوْلِيَٓاءُ بَعْضٍۚ وَاللّٰهُ وَلِيُّ الْمُتَّقٖينَ)** - (Ey Məhəmməd), **sən cahil və nadan zalımları özünə dost seçmə, zalımları onların tayı olan zalımlar dost seçər. Amma müttəqilərin dostu Allah-Təaladır. Onlar da gərək Allah-Təalanı dost seçsinlər, nəinki zalımları.**

هٰذَا بَصَآئِرُ لِلنَّاسِ وَهُدًى وَرَحْمَةٌ لِقَوْمٍ يُوقِنُونَ ﴿٢٠﴾ اَمْ حَسِبَ الَّذِينَ اجْتَرَحُوا السَّيِّاٰتِ اَنْ
نَجْعَلَهُمْ كَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ سَوَآءً مَحْيَاهُمْ وَمَمَاتُهُمْ سَآءَ مَا يَحْكُمُونَ ﴿٢١﴾
وَخَلَقَ اللّٰهُ السَّمٰوَاتِ وَالْاَرْضَ بِالْحَقِّ وَلِتُجْزٰى كُلُّ نَفْسٍ بِمَا كَسَبَتْ وَهُمْ لَا يُظْلَمُونَ ﴿٢٢﴾

---

**20) (هٰذَا بَصَآئِرُ لِلنَّاسِ وَهُدًى وَرَحْمَةٌ لِقَوْمٍ يُوقِنُونَ) - Bu Qurani-Şərifdə verilən din və hikmət əmrləri xalqın qəlb gözlərinin* açılmasına səbəbdir və iman edib, onun haqq olmasına etiqad edənlərdən ötrü zəlalətdən hidayət və əzabdan mərhəmətdir.**

**(*Qeyd:** *"Heyif ki, biz müsəlmanlar adımızı Quran əhli qoyub, özümüzü Qurana tam iman edən hesab edib, hətta ruhanilərimiz özlərini hidayət verən və peyğəmbərin canişini sayırlar. Lakin gözümüz Qurani-Şərifin ziya bəxş edən ayələri ilə nurlanmaq əvəzinə korluğa düçar olub, qəflət və cəhalətdə qalıb əllə tutunacaq bir şey axtarırıq ki, zülmətdən xilas olaq. Əgər belə etsək, yenə ümid var ki, nicat tapaq. Amma həmin zülmətdə qalmağı, (ağac içində olan qurd kimi) özümüzə səadət hesab edib, davamlı zülmət və cəhalətdə səy edirik. Əgər Qurani-Şərifin nuru ilə bizim qəlblərimizin gözü nurlanıb, pasdan saflaşsa idi, bu qədər cahil qalmayıb, cahiliyyə dövründən betər cəhalətə düşməyib, həyat üçün zəruri olan elmləri təhsil etmək üçün xaricilərə möhtac olmazdıq. Hanı o günlər ki, islamın qəndili ilə bir çox millətlər nurlanıb, bununla fəxr edirdilər, o nur hara getdi, necə oldu, məzhəb ixtilafları, ixtilaf həvəsi haradan peyda oldu? İxtilaflar yerlibazlıqdan, təriqətçilikdən, hakimiyyət sevgisindən yarandı. Allahım, şöhrətbazlığa düşməkdən, uydurma rəvayətlərə dalmaqdan bizə nicat ver! Uydurma rəvayətlərə dalıb, Qurana zidd fitva verməklə bir şəxs necə alim və peyğəmbər canişini olar? Bunlara alim demək xətadır. Qurana zidd əməl etmək insanları əbədi fəlakətə düçar edibdir. Qurani-Şərifin nuru islam ümməti arasında yenidən zühur etməsə, bizdən ötrü heç bir qurtuluş ümidi olmayacaq. Bizi ayələrin həqiqətini anlamada müvəffəq edən Allahdır).*

**21) (اَمْ حَسِبَ الَّذِينَ اجْتَرَحُوا السَّيِّاٰتِ اَنْ نَجْعَلَهُمْ كَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ)** - (Ey Məhəmməd), **küfr və günah qazanan şəxslər elə zənn edirlər ki, biz axirətdə onları iman edib, xeyir əməl edən şəxlərlə eyni sayacağıq?**

**(سَوَآءً مَحْيَاهُمْ وَمَمَاتُهُمْ سَآءَ مَا يَحْكُمُونَ) - Necə ki həyatda möminlərlə bərabər, hətta onlardan da yaxşı yaşayırlar, ölüm halətində də onlarla bərabər olacaqlar? Asilərin bu zənnləri batildir. Əgər belə hökm etsələr nə pis hökm edirlər, heç vaxt möminlərlə bərabər olmayıb, möminlər nemət içində, asilər əzab içində olacaqlar.**

**22) (وَخَلَقَ اللّٰهُ السَّمٰوَاتِ وَالْاَرْضَ بِالْحَقِّ وَلِتُجْزٰى كُلُّ نَفْسٍ بِمَا كَسَبَتْ وَهُمْ لَا يُظْلَمُونَ)-**

اَفَرَاَيْتَ مَنِ اتَّخَذَ اِلٰهَهُ هَوٰيهُ وَاَضَلَّهُ اللّٰهُ عَلٰى عِلْمٍ وَخَتَمَ عَلٰى سَمْعِهٖ وَقَلْبِهٖ وَجَعَلَ عَلٰى بَصَرِهٖ
غِشَاوَةًۜ فَمَنْ يَهْدِيهِ مِنْ بَعْدِ اللّٰهِۜ اَفَلَا تَذَكَّرُونَ ﴿٢٣﴾ وَقَالُوا مَا هِيَ اِلَّا حَيَاتُنَا الدُّنْيَا نَمُوتُ وَنَحْيَا
وَمَا يُهْلِكُنَٓا اِلَّا الدَّهْرُۚ وَمَا لَهُمْ بِذٰلِكَ مِنْ عِلْمٍۚ اِنْ هُمْ اِلَّا يَظُنُّونَ﴿٢٤﴾ وَاِذَا تُتْلٰى عَلَيْهِمْ اٰيَاتُنَا بَيِّنَاتٍ
مَا كَانَ حُجَّتَهُمْ اِلَّا اَنْ قَالُوا ائْتُوا بِاٰبَٓائِنَٓا اِنْ كُنْتُمْ صَادِقِينَ ﴿٢٥﴾

---

**Allah-Təala göyləri və yeri haqq və hikmət üzrə yaradıb ki, onun tövhid və qüdrətinə işarə etsinlər və tövhidə inanan və inanmayan hər bir nəfsə qazandığı əməlin qarşılığı verilib, heç vaxt onlara zülm olunmayacaqdır.**

**23)** (اَفَرَاَيْتَ مَنِ اتَّخَذَ اِلٰهَهُ هَوٰيهُ) - (Ey Məhəmməd), **bəs baxıb görürsən o şəxsi ki, nəfsini özünə məbud edib, nəfsinin istədiyi şeylərə tabe olur?**

(وَاَضَلَّهُ اللّٰهُ عَلٰى عِلْمٍ) **Allah-Təala buna agah olub, heç bir şey belə şəxsə fayda verməyib, hidayət tapmayacaqdır. Onu zəlalətdə saxlayar.**

(وَخَتَمَ عَلٰى سَمْعِهٖ وَقَلْبِهٖ ) **- Onun qulağına və qəlbinə elə bir möhür vurar ki, heç bir nəsihət qəbul etməyib, haqqa da etiqad etməz.**

(وَجَعَلَ عَلٰى بَصَرِهٖ غِشَاوَةً) **- Onun gözünə elə bir pərdə salıb ki, haqqı görməkdən gözü kor olubdur.** (فَمَنْ يَهْدِيهِ مِنْ بَعْدِ اللّٰهِۜ اَفَلَا تَذَكَّرُونَ) **- Belə şəxsi Allah-Təala zəlalətə salandan sonra hidayət edib, zəlalətdən çıxaran kimdir? Bəs agah olmursunuz ki, nəfsin istəklərinə tabe olmaq, şər məxluq olmaq xeyir yetirmir?**

**24)** (وَقَالُوا مَا هِيَ اِلَّا حَيَاتُنَا الدُّنْيَا نَمُوتُ وَنَحْيَا وَمَا يُهْلِكُنَٓا اِلَّا الدَّهْرُ) **- Qiyaməti inkar edən müşriklər dedilər: "Dünyadakı həyatımızdan başqa həyat yoxdur. Ölürük və anadan olub dünyaya gəlirik. Bunlar hamısı zəmanənin işidir. Bizi həlak edən gecə və gündüzün gəlib getməsi, zəmanənin keçməsidir. Bizim ölümümüz Allah-Təalanın əmrilə olan deyildir.**

(وَمَا لَهُمْ بِذٰلِكَ مِنْ عِلْمٍۚ اِنْ هُمْ اِلَّا يَظُنُّونَ) - (Ey Məhəmməd), **onların yenidən dirilməyi inkar edib, ölümü zəmanəyə isnad etmələri elm üzrə olmayıb, zənn və fərziyyə ilədir. Zənn insanı həlak edər, elm isə nicat verər.**

**25)** (وَاِذَا تُتْلٰى عَلَيْهِمْ اٰيَاتُنَا بَيِّنَاتٍ) - (Ey Məhəmməd), **yenidən həyat tapıb, dirilməyə işarə edən açıq-aydın ayələrimiz** (Qurani-Şərif) **o zaman ki, müşriklərə oxundu,** (مَا كَانَ حُجَّتَهُمْ اِلَّا اَنْ قَالُوا ائْتُوا بِاٰبَٓائِنَٓا اِنْ كُنْتُمْ صَادِقِينَ) **- Quran ayələrinin müqabilində heç bir dəlil tapa bilməyib** (ey Məhəmməd), **sənə və möminlərə dedilər: "Əgər doğru deyirsinizsə ki, qiyamət vaqe olacaqdır, bizim keçmiş ata-babalarımızı dirildib gətirin ki, qiyamətin haqq olmağına şəhadət etsinlər. Ondan sonra biz də qəbul edək.**

قُلِ اللّٰهُ يُحْيِيكُمْ ثُمَّ يُمِيتُكُمْ ثُمَّ يَجْمَعُكُمْ اِلٰى يَوْمِ الْقِيٰمَةِ لَا رَيْبَ فِيهِ وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ
﴿٢٦﴾ وَلِلّٰهِ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِ وَيَوْمَ تَقُومُ السَّاعَةُ يَوْمَئِذٍ يَخْسَرُ الْمُبْطِلُونَ ﴿٢٧﴾ وَتَرٰى
كُلَّ اُمَّةٍ جَاثِيَةً كُلُّ اُمَّةٍ تُدْعٰى اِلٰى كِتَابِهَا اَلْيَوْمَ تُجْزَوْنَ مَا كُنْتُمْ تَعْمَلُونَ ﴿٢٨﴾ هٰذَا كِتَابُنَا يَنْطِقُ
عَلَيْكُمْ بِالْحَقِّ اِنَّا كُنَّا نَسْتَنْسِخُ مَا كُنْتُمْ تَعْمَلُونَ﴿٢٩﴾ فَاَمَّا الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ
فَيُدْخِلُهُمْ رَبُّهُمْ فِي رَحْمَتِهِ ذٰلِكَ هُوَ الْفَوْزُ الْمُبِينُ﴿٣٠﴾

---

**26) (قُلِ اللّٰهُ يُحْيِيكُمْ ثُمَّ يُمِيتُكُمْ ثُمَّ يَجْمَعُكُمْ اِلٰى يَوْمِ الْقِيٰمَةِ لَا رَيْبَ فِيهِ)** - (Ey Məhəmməd), **qiyaməti inkar edənlərə de: "Allah-Təala sizi yoxdan yaradıb, ondan sonra sizi öldürür, vaqe olmasında heç bir şəkk və şübhə olmayan qiyamət günündə yenidən sizə həyat verib, bir yerə cəm edəcəkdir. İnkar etmək sizə bir fayda verməz. (وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ) Qiyamət günü hökmən vaqe olacaqdır. Lakin insanların əksəriyyəti agah olmayıb, cəhalətdən qiyaməti inkar edirlər.**

**27) (وَلِلّٰهِ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِ) - Qiyamət gününün vaqe olması imkansız işlərdən deyildir və göylərin və yerin səltənəti Allah-Təalaya məxsusdur. Elə bir günü gətirib zalım və asilərdən intiqam almağa da qadirdir. (وَيَوْمَ تَقُومُ السَّاعَةُ يَوْمَئِذٍ يَخْسَرُ الْمُبْطِلُونَ) - Elə ki, qiyamət günü oldu, ogünkü gündə batil danışıb, batil etiqad edənlərin ziyankar olması məlum olar. Heç bir cəhətdən onlara bir fayda olmaz.**

**28) (وَتَرٰى كُلَّ اُمَّةٍ جَاثِيَةً)** - (Ey Məhəmməd), **qiyamət günündə hər bir ümməti qiyamətin şiddətli qorxusundan dizləri üstə çöküb, Allah-Təalanın hökmünün intizarında görərsən. (كُلُّ اُمَّةٍ تُدْعٰى اِلٰى كِتَابِهَا) Hər bir ümmət əməllərinin qeyd olunduğu dəftərlərin tərəfinə dəvət olunarlar ki, gəlin baxıb görək, bu dəftərlərdə nə vardır, nə əməllər edibsiniz?**

**(اَلْيَوْمَ تُجْزَوْنَ مَا كُنْتُمْ تَعْمَلُونَ) - Əməllərinizin qarşılığı sizə veriləcəkdir.**

**29) (هٰذَا كِتَابُنَا يَنْطِقُ عَلَيْكُمْ بِالْحَقِّ) - Qiyamət günündə müşriklərə deyərik: "Budur bizim kitabımız ki, sizin əməlləriniz orada qeyd olunubdur. Haqq və ədalətlə, artıq-əskik olmadan sizin əməllərinizə şəhadət edir.**

**(اِنَّا كُنَّا نَسْتَنْسِخُ مَا كُنْتُمْ تَعْمَلُونَ) - Həqiqətən, sizin əməllərinizin yazılmasını əmr edib, yazdırıb, mühafizə etmişik. Budur əməlləriniz, bugünkü gündə sizə məlum olur.**

**30) (فَاَمَّا الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ فَيُدْخِلُهُمْ رَبُّهُمْ فِي رَحْمَتِهِ ذٰلِكَ هُوَ الْفَوْزُ الْمُبِينُ) - Amma o şəxslər ki, iman edib, xeyir əməl edir, rəbləri Allah-Təala onları öz rəhmətinə daxil edər, açıq-aşkar nicat tapıb savaba qovuşmaq Allah-Təalanın rəhmətinə daxil olmaqdır.**

وَاَمَّا الَّذِينَ كَفَرُواۗ اَفَلَمْ تَكُنْ اٰيَاتٖي تُتْلٰى عَلَيْكُمْ فَاسْتَكْبَرْتُمْ وَكُنْتُمْ قَوْمًا مُجْرِمٖينَ ﴿٣١﴾ وَاِذَا قٖيلَ اِنَّ
وَعْدَ اللّٰهِ حَقٌّ وَالسَّاعَةُ لَا رَيْبَ فٖيهَا قُلْتُمْ مَا نَدْرٖي مَا السَّاعَةُۙ اِنْ نَظُنُّ اِلَّا ظَنًّا وَمَا نَحْنُ بِمُسْتَيْقِنٖينَ
﴿٣٢﴾ وَبَدَا لَهُمْ سَيِّـَٔاتُ مَا عَمِلُوا وَحَاقَ بِهِمْ مَا كَانُوا بِهٖ يَسْتَهْزِؤُ۫نَ ﴿٣٣﴾ وَقٖيلَ الْيَوْمَ نَنْسٰيكُمْ كَمَا
نَسٖيتُمْ لِقَٓاءَ يَوْمِكُمْ هٰذَا وَمَاْوٰيكُمُ النَّارُ وَمَا لَكُمْ مِنْ نَاصِرٖينَ ﴿٣٤﴾ ذٰلِكُمْ بِاَنَّكُمُ اتَّخَذْتُمْ اٰيَاتِ اللّٰهِ
هُزُوًا وَغَرَّتْكُمُ الْحَيٰوةُ الدُّنْيَاۚ فَالْيَوْمَ لَا يُخْرَجُونَ مِنْهَا وَلَا هُمْ يُسْتَعْتَبُونَ ﴿٣٥﴾

---

**31) (وَاَمَّا الَّذِينَ كَفَرُواۗ اَفَلَمْ تَكُنْ اٰيَاتٖي تُتْلٰى عَلَيْكُمْ فَاسْتَكْبَرْتُمْ وَكُنْتُمْ قَوْمًا مُجْرِمٖينَ) - Amma o şəxslər ki küfr və şirk halətində qalıb, iman etmədilər, onlara mənim tərəfimdən deyilər: "Bəs mənim ayələrim (Qurani-Şərif) dünyada sizə oxunmadımı? Əlbəttə, oxundu. Lakin siz təkəbbürlənib, iman etmədiniz, asi və fasiq bir camaat idiniz.**

**32) (وَاِذَا قٖيلَ اِنَّ وَعْدَ اللّٰهِ حَقٌّ وَالسَّاعَةُ لَا رَيْبَ فٖيهَا) - O zaman ki siz müşriklərə dünyada bizim tərəfimizdən peyğəmbər gəlib dedi: "Gəlin Allah-Təalaya iman edin, həqiqətən, Allah-Təalanın o vədi ki, hər bir əmələ qarşılıq verəcək, haqdır. Qiyamət günü də əlbəttə vaqe olacaq. Onda şəkk və şübhə yoxdur."**

**(قُلْتُمْ مَا نَدْرٖي مَا السَّاعَةُۙ اِنْ نَظُنُّ اِلَّا ظَنًّا وَمَا نَحْنُ بِمُسْتَيْقِنٖينَ) - Siz müşriklər inkar edib, cavabında dediniz: "Biz bilmirik ki, qiyamət nə olan şeydir və o haqda elmimiz yoxdur. Ancaq sən peyğəmbərin sözünə görə, qiyamətin vaqe olacağını zənn edirik. Lakin tam inanmamışıq ki, onu qəbul edək."**

**33) (وَبَدَا لَهُمْ سَيِّـَٔاتُ مَا عَمِلُوا وَحَاقَ بِهِمْ مَا كَانُوا بِهٖ يَسْتَهْزِؤُ۫نَ) - Dünyada etdikləri pis əməllər** (böyük günahlar) **onlara məlum olar. O vaxt bilərlər ki, gərək o əməllərin cəzası onlara verilsin. Dünyada haqqa istehza etmələrinin cəzası onları sarıb, əzaba düçar olarlar.**

**34) (وَقٖيلَ الْيَوْمَ نَنْسٰيكُمْ كَمَا نَسٖيتُمْ لِقَٓاءَ يَوْمِكُمْ هٰذَا)** - (Ey Məhəmməd), **o vaxt bizim tərəfimizdən onlara xitab olunub deyilər: "Bu günkü gündə sizi unudub, yaddan çıxardırıq. Necə ki, siz bu günkü günlə qarşılaşmağı unutdunuz. (وَمَاْوٰيكُمُ النَّارُ وَمَا لَكُمْ مِنْ نَاصِرٖينَ) Sizin yeriniz cəhənnəm odudur. Sizə heç bir kömək edən olmaz ki, əzabı sizdən dəf etsin.**

**35) (ذٰلِكُمْ بِاَنَّكُمُ اتَّخَذْتُمْ اٰيَاتِ اللّٰهِ هُزُوًا وَغَرَّتْكُمُ الْحَيٰوةُ الدُّنْيَاۚ) - Sizə edilən bu əzabın səbəbi odur ki, dünya həyatı sizi məğrur edib, aldatdı. Elə xəyal etdiniz ki, dünyada həmişə qalacaqsınız. Allah-Təalanın ayələrini** (Quranı) **oyun, əyləncə sayıb, istehza etdiniz. (فَالْيَوْمَ لَا يُخْرَجُونَ مِنْهَا وَلَا هُمْ يُسْتَعْتَبُونَ)** - (Ey Məhəmməd), **ogünkü gündə asi və fasiqlər nə cəhənnəm odundan çıxarıl-**

فَلِلّٰهِ الْحَمْدُ رَبِّ السَّمٰوَاتِ وَرَبِّ الْاَرْضِ رَبِّ الْعَالَمِينَ ﴿٣٦﴾ وَلَهُ الْكِبْرِيَٓاءُ فِي السَّمٰوَاتِ وَالْاَرْضِۖ وَهُوَ الْعَز۪يزُ الْحَك۪يمُ ﴿٣٧﴾

---

**maz, nə də onların Allah-Təalanı özlərindən razı salmaq üçün edəcəkləri üzrxahlıqları qəbul olunmaz.**

**36) (فَلِلّٰهِ الْحَمْدُ رَبِّ السَّمٰوَاتِ وَرَبِّ الْاَرْضِ رَبِّ الْعَالَمِينَ) - Göylərin, yerin və cəmi aləmlərin rəbbi, tərbiyə edəni Allah-Təalanı həmd-səna etmək layiqdir və bu səbəbdən, gərək, belə Allah-Təalanı həmd-səna edib onu pak və müqəddəs sayaq.**

**37) (وَلَهُ الْكِبْرِيَٓاءُ فِي السَّمٰوَاتِ وَالْاَرْضِۖ وَهُوَ الْعَز۪يزُ الْحَك۪يمُ) - Göylərdə və yerdə böyüklük Allah-Təalaya məxsusdur. Məxluqata qalib olub, hər bir feilində hikmət sahibi olan Allah-Təaladır.**

**Allaha həmd olsun, Casiyə surəsinin təfsiri tamamlandı. Bu mübarək surədə Allah-Təalanın tövhid və qüdrətinə işarə edən açıq-aydın ayələrə gərək fikir verib təfəkkür edilsin və bu səbəbdən qiyamətin vaqe olacağına işarə edən ayələrdən gərək qafil olunmasın. Allahın Rəsulu buyurubdur: "Kim Casiyə surəsini oxusa, Allah-Təala haqq-hesab günündə onun sirlərini gizlədib, qorxusunu yox edər."**

## əl-ƏHQAF SURƏSİ

46-cı surədir. Məkkədə nazil olub, 36 ayə, 644 kəlmə və 2595 hərfdir.

حٰمٓ ﴿١﴾ تَنْزِيلُ الْكِتَابِ مِنَ اللّٰهِ الْعَزِيزِ الْحَكِيمِ ﴿٢﴾ مَا خَلَقْنَا السَّمٰوَاتِ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَٓا
اِلَّا بِالْحَقِّ وَاَجَلٍ مُسَمًّى وَالَّذِينَ كَفَرُوا عَمَّٓا اُنْذِرُوا مُعْرِضُونَ ﴿٣﴾ قُلْ اَرَاَيْتُمْ مَا تَدْعُونَ مِنْ دُونِ
اللّٰهِ اَرُونِي مَاذَا خَلَقُوا مِنَ الْاَرْضِ اَمْ لَهُمْ شِرْكٌ فِي السَّمٰوَاتِ اِيتُونِي بِكِتَابٍ مِنْ قَبْلِ هٰذَٓا اَوْ اَثَارَةٍ
مِنْ عِلْمٍ اِنْ كُنْتُمْ صَادِقِينَ ﴿٤﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (**حٰمٓ**) - Bu mübarək surənin adıdır.**

**2) (**تَنْزِيلُ الْكِتَابِ مِنَ اللّٰهِ الْعَزِيزِ الْحَكِيمِ**) - Bu kitabın** (Quranın) **nazil olunması məxluqata qalib olan və hər bir feili hikmət üzrə meydana gələn Allah-Təalanın tərəfindəndir.**

**3) (**مَا خَلَقْنَا السَّمٰوَاتِ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَٓا اِلَّا بِالْحَقِّ وَاَجَلٍ مُسَمًّى**) - Göyləri və yeri və onların arasında olan məxluqatı ancaq hikmət və doğru bir məqsəd üzrə və müəyyən bir vaxt üçün yaratdıq. O müəyyən vaxtda** (qiyamət günündə) **hamısı məhv olacaqlar. (**وَالَّذِينَ كَفَرُوا عَمَّٓا اُنْذِرُوا مُعْرِضُونَ**) - Amma kafir və müşriklər peyğəmbərlər tərəfindən xəbərdarlıq edilən qiyamət gününün şiddətli qorxusundan çəkinməyib, iman etməyib elə bir günə hazırlaşmadılar.**

**4) (**قُلْ اَرَاَيْتُمْ مَا تَدْعُونَ مِنْ دُونِ اللّٰهِ**)** - (Ey Məhəmməd), **müşriklərə de ki, o bütlər ki, Allah-Təaladan başqa onlara sitayiş edib ibadət edirsiniz, onları mənə xəbər verin. (**اَرُونِي مَاذَا خَلَقُوا مِنَ الْاَرْضِ**) Göstərin mənə onları, əgər qüdrət sahibləridirlərsə, yer üzündə olan şeylərdən hansı birini yaradıblar?**

**(**اَمْ لَهُمْ شِرْكٌ فِي السَّمٰوَاتِ**) - Yoxsa dediyiniz kimi göylərin yaradılmasında o bütlər Allah-Təala ilə şərikdirlər?**

**(**اِيتُونِي بِكِتَابٍ مِنْ قَبْلِ هٰذَٓا اَوْ اَثَارَةٍ مِنْ عِلْمٍ اِنْ كُنْتُمْ صَادِقِينَ**) - Bütlərə sitayiş edib, Allah-Təalaya şərik qoşmaqda əgər doğru deyirsinizsə, bu Qurandan əvvəl Allah-Təala tərəfindən nazil olan bir kitab, ya da ki keçmişdən sizə qalan bir elm, ya bir dəlil gətirin ki, sizin sözünüzün doğruluğuna şəhadət**

وَمَنْ اَضَلُّ مِمَّنْ يَدْعُوا مِنْ دُونِ اللّٰهِ مَنْ لَا يَسْتَجِيبُ لَهُ اِلٰى يَوْمِ الْقِيٰمَةِ وَهُمْ عَنْ دُعَٓائِهِمْ غَافِلُونَ ﴿٥﴾ وَاِذَا حُشِرَ النَّاسُ كَانُوا لَهُمْ اَعْدَٓاءً وَكَانُوا بِعِبَادَتِهِمْ كَافِرِينَ﴿٦﴾ وَاِذَا تُتْلٰى عَلَيْهِمْ اٰيَاتُنَا بَيِّنَاتٍ قَالَ الَّذِينَ كَفَرُوا لِلْحَقِّ لَمَّا جَٓاءَهُمْ هٰذَا سِحْرٌ مُبِينٌ ﴿٧﴾ اَمْ يَقُولُونَ افْتَرٰيهُ قُلْ اِنِ افْتَرَيْتُهُ فَلَا تَمْلِكُونَ لِي مِنَ اللّٰهِ شَيْـًٔا هُوَ اَعْلَمُ بِمَا تُفِيضُونَ فِيهِ كَفٰى بِهِ شَهِيدًا بَيْنِي وَبَيْنَكُمْ وَهُوَ الْغَفُورُ الرَّحِيمُ ﴿٨﴾

---

**etsinlər. Necə ki Quran tövhidə və şirkin batil olmasına şəhadət edir. Bunların heç biri olmayanda dəlilsiz söz qəbul olunmaz.**

**5) (وَمَنْ اَضَلُّ مِمَّنْ يَدْعُوا مِنْ دُونِ اللّٰهِ مَنْ لَا يَسْتَجِيبُ لَهُ اِلٰى يَوْمِ الْقِيٰمَةِ وَهُمْ عَنْ دُعَٓائِهِمْ غَافِلُونَ)** - (Ey Məhəmməd), **bir şəxs ki, Allah-Təaladan başqa bütlərə dua və ibadət etsə, hansı ki, o bütlər qiyamətə kimi onun heç bir ehtiyacını həll etməyib, ona cavab verməz, belə şəxsdən daha çox zəlalətdə olan kimdir? Halbuki onların ibadət və dua etmələrindən o bütlər qafildir.** (Ey Məhəmməd), **dünyada müşriklərlə bütlərin halı belədir.**

**6) (وَاِذَا حُشِرَ النَّاسُ كَانُوا لَهُمْ اَعْدَٓاءً وَكَانُوا بِعِبَادَتِهِمْ كَافِرِينَ) - Amma elə ki, qiyamət günü olub insanlar bir yerə cəm oldular, o vaxt bütlər onlara ibadət edənlərə düşmən olub, onların ibadət etməsini inkar edərlər.** (Qiyamət günündə bütlər hal və dil ilə deyərlər: "İlahi, biz insanları özümüzə ibadət etməyə dəvət etmədik. Bəlkə onlar özləri dünya ilə təkəbbürlənib, bizə ibadət etdilər).

**7) (وَاِذَا تُتْلٰى عَلَيْهِمْ اٰيَاتُنَا بَيِّنَاتٍ قَالَ الَّذِينَ كَفَرُوا لِلْحَقِّ لَمَّا جَٓاءَهُمْ هٰذَا سِحْرٌ مُبِينٌ)** - (Ey Məhəmməd), **o zaman ki, kafir və müşriklərə bizim tövhid və qüdrətimizə açıq-aşkar işarə edən ayələrimiz** (Qurani-Şərif) **oxundu, haqq** (Quran) **onlara gələn vaxt kafirlər dedilər: "Bu Quran açıq-aşkar sehrdir. Bunda heç bir haqq şey yoxdur.**

**8) (اَمْ يَقُولُونَ افْتَرٰيهُ) - Yoxsa müşriklər bir-birilərinə** (Məhəmmədin) **bu Quranla Allah-Təalaya iftira etdiyini deyirlər? (قُلْ اِنِ افْتَرَيْتُهُ فَلَا تَمْلِكُونَ لِي مِنَ اللّٰهِ شَيْـًٔا)** - (Ey Məhəmməd), **onların cavabında de ki, əgər mən bu Quranla Allah-Təalaya iftira etmiş olsam, Allah-Təala bu iftira səbəbi ilə özü mənə əzab edər. Siz Allah-Təalanın əzabını məndən dəf etməyə qadir olmazsınız.**

**(هُوَ اَعْلَمُ بِمَا تُفِيضُونَ فِيهِ) - Allah-Təalanın özü sizin dediyiniz sözlərə agahdır.**

**(كَفٰى بِهِ شَهِيدًا بَيْنِي وَبَيْنَكُمْ وَهُوَ الْغَفُورُ الرَّحِيمُ) - Mənimlə sizin aranızda Allah-Təalanın şahid olması kifayət edər. Mənim doğruluğuma, sizin yalançılığınıza şəhadət edər. Lakin küfr və şirkdən tövbə edənlərə rəhm edib bağışlayandır.** (Müşriklər Allah Rəsulundan hər bir möcüzəni soruşub, qeyb elmini bilmək istəyirdilər. Növbəti ayə ilə onlara cavab verməyə məsul oldu).

قُلْ مَا كُنْتُ بِدْعًا مِنَ الرُّسُلِ وَمَآ اَدْرِي مَا يُفْعَلُ بِي وَلَا بِكُمْ ۗ

---

**9) (قُلْ مَا كُنْتُ بِدْعًا مِنَ الرُّسُلِ وَمَآ اَدْرِي مَا يُفْعَلُ بِي وَلَا بِكُمْ)** - (Ey Məhəmməd), **müşriklərə cavab verib de ki, mən peyğəmbərlərin ilki deyiləm ki,* hər bir möcüzəni və qeyb elmini məndən istəyəsiniz, mən də sizdən ötrü gətirim, gətirməyəndə məni inkar edəsiniz, necə ki məndən əvvəl peyğəmbərlər olub, Allah-Təaladan onlara gələn hər bir hökmü insanlara çatdırıblar, yoxsa özlərindən möcüzə gətirməyiblər. Mən də onlar kimi bir peyğəmbərəm, siz istəyən möcüzələri gətirməyə qadir deyiləm. Məndən qeyb elmini istəyirsiniz. Mən heç öz əhvalıma agah deyiləm ki, bundan sonra ilahi qədər mənim haqqımda necə olub, işim necə gedəcək? Habelə sizin gələcəyinizə də agah deyiləm ki, bundan sonra sizin işiniz necə olacaq. Belə olan halda qeyb elminə necə agah olum? Mənim qeyb elmindən xəbərim yoxdur.**

**(*Qeyd:** *"Quran əhli bu ayəyə baxdığı zaman görəcəklər ki, peyğəmbərimiz özündəki fövqəladə halları və qeyb elmini bilməsini inkar edir. Buna baxıb, nəinki uca peyğəmbərə, hidayət verən imamlara və böyük səhabələrə, hətta fəqihlərə və sufilərə belə qeyb elminə agah olmaq xüsusiyyətini isnad etməsinlər, belə işlərlə məşğul olmaqdan din və dünya işlərini unudublar. Hər qrup ancaq öz rəisini elm və fəzilətdə ərşdən sürəyya ulduzuna qədər, zamanın yaranmasından qiyamətə qədər hər bir zərrəyə agah olmasını uydurub, Quran ayələrini yozub, bir-birləri ilə qovğa etməyə məşğul olarkən, hər bir qrup öz rəisinin fəzilətini yüksəltmək, digərlərini alçaltmaq üçün səy edir. Allah, bu nə din, bu nə məzhəb, bu nə təriqətdir, islam dini budurmu? Belə işlərlə məşğul olmaqdan, cəhalət və nadanlıqdan başqa bir şey hasil olmaz. Hər bir qrup öz rəisinin din və islam ümməti barəsində dediyi sözlərə və xitablara əgər diqqət edib fikir versələr, hər halda islam ümməti belə fəlakət və rəzalət gününə düçar olmazlar. Müsəlmanlara baxanda görürsən ki, hər bir qrup nəinki öz hərəkətini, gündəlik çalışmasını, yatıb, durmasını, hətta günah əməllərini də Allah-Təalaya həvalə edib, özlərini ixtiyarları əllərindən alınmış kimi göstərib, axirətdəki qurtuluşlarını, dünyada xoşbəxtlik və üstünlüyə çatmalarını ilahi qədərə həvalə edib özlərini faydasız, bir parça murdar və nəcis şey kimi qələmə verirlər. Guya bunlar Qurani-Şərifdə cihad və birlik barəsində varid olan ayələri oxumayıblar və səbəblərini dərk etməyiblər. Başqa bir qrup məişət işində Allah-Təalanı əlaqəsiz, özlərini mütləq hakim bilib, mal yığmaqda, cah-cəlal sahibi olmaqda sonsuz səy edib, gecə və gündüz rahat olmağı özlərinə haram saydılar. Lakin dinin yayılması və islam ümmətinin tərəqqisi üçün var-dövlət və ya dillə kömək edib, səy etməkdə özlərini qüdrətsiz göstərib, bu işləri Allah-Təalaya həvalə etdilər. Əgər Allah-Təala istəsə özü öz dininə kömək edər, bizə öz məişətimiz üçün çalışmaq lazımdır, mənim din və millət barəsində danışıb, kömək etməyə, ya da ki, belə məclislərə getməyə vaxtım yoxdur, deyib varislərdən ötrü mal yığmaqla məşğul olurlar. Hansı ki, özü həlak olandan sonra*

اِنْ اَتَّبِعُ اِلَّا مَا يُوحٰى اِلَيَّ وَمَٓا اَنَا۬ اِلَّا نَذِيرٌ مُبِينٌ ﴿٩﴾ قُلْ اَرَاَيْتُمْ اِنْ كَانَ مِنْ عِنْدِ اللّٰهِ وَكَفَرْتُمْ بِهٖ وَشَهِدَ
شَاهِدٌ مِنْ بَنٖٓي اِسْرَٓاءِيلَ عَلٰى مِثْلِهٖ فَاٰمَنَ وَاسْتَكْبَرْتُمْ ۜ اِنَّ اللّٰهَ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمٖينَ ۟ ﴿١٠﴾ وَقَالَ
الَّذٖينَ كَفَرُوا لِلَّذٖينَ اٰمَنُوا لَوْ كَانَ خَيْرًا مَا سَبَقُونَٓا اِلَيْهِ ۜ وَاِذْ لَمْ يَهْتَدُوا بِهٖ فَسَيَقُولُونَ هٰذَٓا اِفْكٌ قَدٖيمٌ ﴿١١﴾

---

*varisləri onun ruhunun xəbisliyini daha da artıracaqlar. Başqa bir qrup isə din və ümmətin işlərinin islahı və tərəqqisini uca peyğəmbərin möcüzəli bəyanı ilə vəd edilən Mehdinin zühuruna həvalə edirlər. Mehdi özü gəlib islama qüvvət verər, deyib istirahətlə məşğul olurlar. Görəsən, islam dininin əsası belə qoyuldu? İlahi, islam ümmətinə ağıl bəxş et!)*

**(اِنْ اَتَّبِعُ اِلَّا مَا يُوحٰى اِلَيَّ وَمَٓا اَنَا۬ اِلَّا نَذِيرٌ مُبِينٌ) Hər bir əmr ki, Allah-Təaladan mənə vəhy olunur, mən ancaq o əmrə tabe olub sizə bildirəcəm, mənim əmrim və işim Allah-Təalanın əzab və cəzası ilə sizi açıq-aşkar qorxutmaqdır ki, küfr və şirki tərk edib müvəhhid olasınız.**

**10) (قُلْ اَرَاَيْتُمْ اِنْ كَانَ مِنْ عِنْدِ اللّٰهِ وَكَفَرْتُمْ بِهٖ)** - (Ey Məhəmməd), **müşriklərə de ki, əgər bu Quran mənə Allah-Təalanın tərəfindən gəlmiş olsa və ona kafir olsanız, o vaxt Allah-Təalanın hüzurunda nə cavab verəcəksiniz? (وَشَهِدَ شَاهِدٌ مِنْ بَنٖٓي اِسْرَٓاءِيلَ عَلٰى مِثْلِهٖ فَاٰمَنَ وَاسْتَكْبَرْتُمْ ۜ اِنَّ اللّٰهَ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمٖينَ) - Necə olur ki, Bəni-İsraildən bir nəfər* şahid Quranın bir bənzəri olan Tövratın haqq olmağına şəhadət edən Quranı təsdiq edib iman edir, lakin siz Qüreyş camaatı** (Məhəmmədin) **yaxın qohumları olduğunuz halda yenə də təkəbbürlənib, iman etmirsiniz? Görəsən, belə olan halda siz zalım deyilsinizmi? Həqiqətən, Allah-Təala zalım camaata hidayət etməz, bəlkə onlardan yardımını kəsib, zəlalətdə qalıb, əzaba düçar olarlar.**

**(*Qeyd:** *"Bəni-İsraildən Qurana ilk iman gətirən şahid peyğəmbər Mədinəyə hicrət edəndən sonra yəhudilərin böyük alimlərindən olan Abdullah ibn Səlam idi. Allah Rəsulunun hüzuruna gedib, o cənabın mübarək simasından onun haqlı olduğunu anlayıb, iman etdi. Abdullah ibn Səlam Mədinədə iman edibdir. Lakin Qüreyşə tənə etmək üçün Allah-Təala əvvəlcədən Məkkədə onun imanını xəbər verib, onu şahid adlandırır).*

**11) (وَقَالَ الَّذٖينَ كَفَرُوا لِلَّذٖينَ اٰمَنُوا لَوْ كَانَ خَيْرًا مَا سَبَقُونَٓا اِلَيْهِ) - Məkkəli Qüreyş camaatının kafirləri bir-biriləri ilə məsləhətləşib, Qurana iman edənlərin haqqında belə dedilər: "Əgər Qurana və** (Məhəmmədə) **iman etmək xeyirli bir əməl olsaydı, iman edənlər imana girməkdə bizi keçə bilməzdilər. Biz onlardan qabaq iman edərdik. İndi ki, onlar bizdən əvvəl iman ediblər, məlum olur ki, bu, xeyirli bir əməl deyilmiş. (وَاِذْ لَمْ يَهْتَدُوا بِهٖ فَسَيَقُولُونَ هٰذَٓا اِفْكٌ قَدٖيمٌ)** - (Ey Məhəmməd), **elə ki, müşriklər bu Quranla hidayət tapmayıb, iman etmədilər, onların inad və asilikləri aşkar olub, əlbəttə deyəcəklər ki, bu Quran köhnə, yalan sözlərdir. Biz ona iman etmərik.**

وَمِنْ قَبْلِه۪ كِتَابُ مُوسٰٓى اِمَامًا وَرَحْمَةًۜ وَهٰذَا كِتَابٌ مُصَدِّقٌ لِسَانًا عَرَبِيًّا لِيُنْذِرَ الَّذ۪ينَ ظَلَمُواۗ وَبُشْرٰى
لِلْمُحْسِن۪ينَ﴿١٢﴾ اِنَّ الَّذ۪ينَ قَالُوا رَبُّنَا اللّٰهُ ثُمَّ اسْتَقَامُوا فَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَۚ ﴿١٣﴾
اُو۬لٰٓئِكَ اَصْحَابُ الْجَنَّةِ خَالِد۪ينَ ف۪يهَاۚ جَزَٓاءً بِمَا كَانُوا يَعْمَلُونَ ﴿١٤﴾ وَوَصَّيْنَا الْاِنْسَانَ بِوَالِدَيْهِ
اِحْسَانًاۜ حَمَلَتْهُ اُمُّهُ كُرْهًا وَوَضَعَتْهُ كُرْهًاۜ وَحَمْلُهُ وَفِصَالُهُ ثَلٰثُونَ شَهْرًاۜ حَتّٰٓى اِذَا بَلَغَ اَشُدَّهُ وَبَلَغَ
اَرْبَع۪ينَ سَنَةًۙ قَالَ رَبِّ اَوْزِعْن۪ٓي اَنْ اَشْكُرَ نِعْمَتَكَ الَّت۪ٓي اَنْعَمْتَ عَلَيَّ وَعَلٰى وَالِدَيَّ

---

**12) (وَمِنْ قَبْلِه۪ كِتَابُ مُوسٰٓى اِمَامًا وَرَحْمَةً)** - (Ey Məhəmməd), **bu Qurandan əvvəl Musanın kitabını** (Tövratı) **insanlardan ötrü din və ehkam əmrlərində rəhbər və rəhmət olduğu halda Bəni-İsrailə verdik.**

**(وَهٰذَا كِتَابٌ مُصَدِّقٌ لِسَانًا عَرَبِيًّا لِيُنْذِرَ الَّذ۪ينَ ظَلَمُواۗ وَبُشْرٰى لِلْمُحْسِن۪ينَ) - Bu Quran ərəb dilində bir kitab olduğu halda Tövratı təsdiq edir, ta ki, zalım şəxsləri Allah-Təalanın əzabı ilə qorxudub, yaxşı əməl sahiblərini müjdələsin.**

**13) (اِنَّ الَّذ۪ينَ قَالُوا رَبُّنَا اللّٰهُ ثُمَّ اسْتَقَامُوا فَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ)** - (Ey Məhəmməd), **həqiqətən, o şəxslər ki rəbbimiz yeganə Allah-Təaladır, deyib hər bir işlərini ancaq Allah-Təalaya həvalə edib, ondan sonra bu sözlərində möhkəm və sabit duralar, qiyamət gününün əzab və şiddətindən onlara qorxu yoxdur, nə də qəmgin olmazlar.**

**14) (اُو۬لٰٓئِكَ اَصْحَابُ الْجَنَّةِ خَالِد۪ينَ ف۪يهَاۚ جَزَٓاءً بِمَا كَانُوا يَعْمَلُونَ) - Bunlar cənnət yoldaşlarıdırlar, dünyada etdikləri yaxşı əməllərinin əvəzinə görə cənnətə daxil olub, orada həmişəlik qalacaqlar.**

**15) (وَوَصَّيْنَا الْاِنْسَانَ بِوَالِدَيْهِ اِحْسَانًاۜ)** - (Ey Məhəmməd), **biz hökm edib, vacib etdik ki, hər bir insan gərək öz valideynlərinə** (xüsusən anasına) **yaxşılıq edib, onlarla gözəl rəftar etsin. (حَمَلَتْهُ اُمُّهُ كُرْهًا وَوَضَعَتْهُ كُرْهًاۜ) - Çünki anası ona zəhmət və məşəqqətlə hamilə olub, zəhmət və məşəqqətlə də onu doğubdur. Bu səbəbdən ananın haqqı daha çoxdur. (وَحَمْلُهُ وَفِصَالُهُ ثَلٰثُونَ شَهْرًا) - Ananın uşağa hamilə olub, ondan sonra onu doğub, süd verib, süddən aralanana kimi* vaxtı 30 aylıq müddətdir,** (yəni hamilə olub süd vermək zamanı 30 ayda gərək tamamlansın, 30 aydan çox olmaz).

**(حَتّٰٓى اِذَا بَلَغَ اَشُدَّهُ وَبَلَغَ اَرْبَع۪ينَ سَنَةً) - Elə ki, ana o uşağı süddən ayırıb, uşağın yavaş-yavaş huşu, idrakı çoxaldı, ta ki, rüşd, hidayət məqamına** (yaxşını, pisi fərqləndirib, gözəli, çirkini dərk etmək məqamına) **çatıb və ondan sonra 40 yaşında gücünün və ağlının yetkinlik məqamına yetişdi, (قَالَ رَبِّ اَوْزِعْن۪ٓي اَنْ اَشْكُرَ نِعْمَتَكَ الَّت۪ٓي اَنْعَمْتَ عَلَيَّ وَعَلٰى وَالِدَيَّ) - Belə məqamda bizi yad edib, müvəhhid olub dedi: "Ey mənim rəbbim, mənə ilham edib bildir, ta**

وَاَنْ اَعْمَلَ صَالِحًا تَرْضٰيهُ وَاَصْلِحْ لِي فِي ذُرِّيَّتِي ۚ اِنِّي تُبْتُ اِلَيْكَ وَاِنِّي مِنَ الْمُسْلِمِينَ ﴿١٥﴾ اُولٰٓئِكَ الَّذِينَ نَتَقَبَّلُ عَنْهُمْ اَحْسَنَ مَا عَمِلُوا وَنَتَجَاوَزُ عَنْ سَيِّاٰتِهِمْ فِيٓ اَصْحَابِ الْجَنَّةِ ۜ وَعْدَ الصِّدْقِ الَّذِي كَانُوا يُوعَدُونَ ﴿١٦﴾ وَالَّذِي قَالَ لِوَالِدَيْهِ اُفٍّ لَكُمَٓا اَتَعِدَانِنِيٓ اَنْ اُخْرَجَ وَقَدْ خَلَتِ الْقُرُونُ مِنْ قَبْلِي وَهُمَا يَسْتَغِيثَانِ اللّٰهَ وَيْلَكَ اٰمِنْ ۗ اِنَّ وَعْدَ اللّٰهِ حَقٌّ ۚ

---

**ki, mənə və valideynlərimə verən nemətlərə şükür edim (وَاَنْ اَعْمَلَ صَالِحًا) və razı olacağın xeyir əməl edim.**

(***Qeyd:** *"İbn Abbas deyib: "Əgər ana uşağı 9 aydan sonra doğsa, o vaxt 21 ay süd verər və əgər 6 aydan sonra doğsa, 24 ay süd verər. Nisa surəsində süd vermə müddətinin 2 il olaraq qeyd edilməsindən, həm də bu ayədən hamiləlik müddətinin ən az 6 ay olduğu anlaşılır. Lakin Allah-Təala hamiləlik müddətini bəyan etməyibdir. Ola bilər ki, az və ya çox olsun, amma ən çox yayılan 9 aylıq müddəti nəzərə alanda süd vermə müddətinin 21 ay olması məlum olur. Nisa surəsində də süd vermə müddətinin 2 il göstərilməsi məcburi olmasından deyil, könüllülük prinsipi ilədir. Süd verən ana uşağın halını nəzərə alıb, bu müddəti az və ya çox tuta bilər və bu səbəbdən Nisa surəsindəki ayəni hamiləlik müddətinin ən az 6 ay olmasına dəlil saymaq lazım deyildir. Necə ki, bəzi təfsirçilər də belə deyiblər. Hamiləlik müddətini 1 ildən 4 ilə kimi deyənlərin sözünü də bu ayə təkzib edir).*

(تَرْضٰيهُ وَاَصْلِحْ لِي فِي ذُرِّيَّتِي ۚ اِنِّي تُبْتُ اِلَيْكَ وَاِنِّي مِنَ الْمُسْلِمِينَ) - **Mənim övladlarımı islah edib, onları xeyir əməl sahibi et. Həqiqətən, mən hər bir işimdə sənə yönəlib, sənə itaət edənlərdənəm.**

**16)** (اُولٰٓئِكَ الَّذِينَ نَتَقَبَّلُ عَنْهُمْ اَحْسَنَ مَا عَمِلُوا وَنَتَجَاوَزُ عَنْ سَيِّاٰتِهِمْ فِيٓ اَصْحَابِ الْجَنَّةِ) - (Ey Məhəmməd), **bu duaları edənlər elə şəxslərdirlər ki, onların xeyir əməllərini qəbul edib, cənnət əhlinin arasında olduqları halda kiçik günahlarından keçərik.** (وَعْدَ الصِّدْقِ الَّذِي كَانُوا يُوعَدُونَ) **- Yaxşı əməlləri qəbul edib, günahlardan keçmək Allah-Təalanın doğru vədidir ki, onlara verilir. Allah-Təala vədində xilaf etməz.** (Əvvəlki ayədə Allah-Təala valideynlərinə itaət edən müvəhhid şəxslərin aqibətini bəyan etdi. Növbəti ayədə Allah-Təalaya asi olub, ata və analarına ağ olanların aqibətini bəyan edir).

**17)** (وَالَّذِي قَالَ لِوَالِدَيْهِ اُفٍّ لَكُمَٓا اَتَعِدَانِنِيٓ اَنْ اُخْرَجَ وَقَدْ خَلَتِ الْقُرُونُ مِنْ قَبْلِي) - (Ey Məhəmməd), **o şəxs ki, özü müşrik olub, müvəhhid ata-anası onu haqq və tövhidə dəvət etsə o şəxs də cavabında ata-anasına desə ki, sizin bu sözünüzdən incidim, bəs mənə vəd edirsiniz ki, mən öləndən sonra yenidən dirilib qəbrimdən çıxacağam? Halbuki məndən əvvəl çox ümmətlər keçiblər. Heç onlardan dirilib, qəbirdən çıxan olmayıbdır. Bunlar mənasız sözlərdir.** (وَهُمَا يَسْتَغِيثَانِ اللّٰهَ وَيْلَكَ اٰمِنْ ۗ اِنَّ وَعْدَ اللّٰهِ حَقٌّ) **Amma onun valideynləri onun sö-**

فَيَقُولُ مَا هٰذَآ اِلَّا اَسَاطِيرُ الْاَوَّلِينَ ﴿١٧﴾ اُو۬لٰٓئِكَ الَّذِينَ حَقَّ عَلَيْهِمُ الْقَوْلُ فٖيٓ اُمَمٍ قَدْ خَلَتْ مِنْ
قَبْلِهِمْ مِنَ الْجِنِّ وَالْاِنْسِؕ اِنَّهُمْ كَانُوا خَاسِرٖينَ ﴿١٨﴾ وَلِكُلٍّ دَرَجَاتٌ مِمَّا عَمِلُواۚ وَلِيُوَفِّيَهُمْ اَعْمَالَهُمْ
وَهُمْ لَا يُظْلَمُونَ﴿١٩﴾ وَيَوْمَ يُعْرَضُ الَّذٖينَ كَفَرُوا عَلَى النَّارِؕ اَذْهَبْتُمْ طَيِّبَاتِكُمْ فٖي حَيَاتِكُمُ الدُّنْيَا
وَاسْتَمْتَعْتُمْ بِهَاۚ فَالْيَوْمَ تُجْزَوْنَ عَذَابَ الْهُونِ بِمَا كُنْتُمْ تَسْتَكْبِرُونَ فِي الْاَرْضِ بِغَيْرِ الْحَقِّ وَبِمَا كُنْتُمْ
تَفْسُقُونَ۠ ﴿٢٠﴾ وَاذْكُرْ اَخَا عَادٍؕ اِذْ اَنْذَرَ قَوْمَهُ بِالْاَحْقَافِ

---

**zündən Allah-Təalaya pənah aparıb, ona deyərlər: "Vay olsun sənə, belə sözləri tərk edib Allah-Təalaya iman et. Həqiqətən, Allah-Təalanın o vədi ki, qiyamət günü vaqe olacaq, haqq və doğrudur. Əlbəttə, vaqe olacaqdır. (فَيَقُولُ مَا هٰذَآ اِلَّا اَسَاطِيرُ الْاَوَّلِينَ) - O şəxs ata-anasının cavabında deyər: "Bu sözlər ki, siz deyirsiniz, əvvəlkilərin mənasız sözləridir. Onların doğruluğu məlum olmayıbdır.**

**18) (اُو۬لٰٓئِكَ الَّذِينَ حَقَّ عَلَيْهِمُ الْقَوْلُ فٖيٓ اُمَمٍ قَدْ خَلَتْ مِنْ قَبْلِهِمْ مِنَ الْجِنِّ وَالْاِنْسِؕ اِنَّهُمْ كَانُوا خَاسِرٖينَ)** - (Ey Məhəmməd), **bu qeyd olunanlar o şəxslərdir ki, onlardan əvvəlki cin və insanlardan olan ümmətlərlə birlikdə onlara əzab edilməsi haqq və layiq oldu. Həqiqətən, onlar nəfslərinə zərər verən camaat idilər. Ona görə onlara əzab olunacaqdır.**

**19) (وَلِكُلٍّ دَرَجَاتٌ مِمَّا عَمِلُواۚ وَلِيُوَفِّيَهُمْ اَعْمَالَهُمْ وَهُمْ لَا يُظْلَمُونَ) - Allah-Təala müti və asi hər iki camaatın əməllərinin cəzasını onlara verməklə onların hər birindən ötrü dərəcələr təyin etdi. Belə ki, hər bir şəxsin xeyir və şər əməlinə görə ona həmin dərəcədə qarşılıq versin və cəza vermək əməlin müqabilində olduğuna görə onlara zülm olunmayacaqdır.**

**20) (وَيَوْمَ يُعْرَضُ الَّذٖينَ كَفَرُوا عَلَى النَّارِؕ) - Qiyamət günündə elə ki, kafirlər əzabdan ötrü cəhənnəm oduna aparılıb, əzab onları yaxaladı, (اَذْهَبْتُمْ طَيِّبَاتِكُمْ فٖي حَيَاتِكُمُ الدُّنْيَا وَاسْتَمْتَعْتُمْ بِهَاۚ) - o vaxt** (ey Məhəmməd), **bizim tərəfimizdən onlara deyilər: "Sizdən ötrü dünyada pak yeməklər və ləzzət verən şeylər ki, verilmişdi, hamısına qovuşub, istədiyiniz kimi sərf edib, ləzzət aldınız. Bu günkü günə özünüzdən ötrü bir şey saxlamadınız.**

**(فَالْيَوْمَ تُجْزَوْنَ عَذَابَ الْهُونِ بِمَا كُنْتُمْ تَسْتَكْبِرُونَ فِي الْاَرْضِ بِغَيْرِ الْحَقِّ وَبِمَا كُنْتُمْ تَفْسُقُونَ) - Dünyada, yer üzündə haqsız və ədalətsiz olaraq təkəbbürlənib, fasiq olduğunuz üçün bugünkü** (qiyamət) **günündə sizə cəza olaraq zəlil və rəzil edən əzab verilər.**

**21) (وَاذْكُرْ اَخَا عَادٍؕ اِذْ اَنْذَرَ قَوْمَهُ بِالْاَحْقَافِ)** - (Ey Məhəmməd), **Ad camaatının qardaşı** (yəni onların özündən olan) **Hud peyğəmbəri xatırlayıb, yadına sal. O zaman ki, öz xalqını** (Əhqaf)* **adlı yerdə bizim əzabımızla qorxudub, tövhidə dəvət etdi,**

وَقَدْ خَلَتِ النُّذُرُ مِنْ بَيْنِ يَدَيْهِ وَمِنْ خَلْفِهٖٓ اَلَّا تَعْبُدُوٓا اِلَّا اللّٰهَ ۜ اِنّٖيٓ اَخَافُ عَلَيْكُمْ عَذَابَ يَوْمٍ عَظٖيمٍ
﴿٢١﴾ قَالُوٓا اَجِئْتَنَا لِتَاْفِكَنَا عَنْ اٰلِهَتِنَاۚ فَاْتِنَا بِمَا تَعِدُنَآ اِنْ كُنْتَ مِنَ الصَّادِقٖينَ ﴿٢٢﴾ قَالَ اِنَّمَا الْعِلْمُ
عِنْدَ اللّٰهِ ۘ وَاُبَلِّغُكُمْ مَآ اُرْسِلْتُ بِهٖ وَلٰكِنّٖيٓ اَرٰيكُمْ قَوْمًا تَجْهَلُونَ ﴿٢٣﴾ فَلَمَّا رَاَوْهُ عَارِضًا مُسْتَقْبِلَ
اَوْدِيَتِهِمْ ۙ قَالُوا هٰذَا عَارِضٌ مُمْطِرُنَا ۜ بَلْ هُوَ مَا اسْتَعْجَلْتُمْ بِهٖ ۜ رٖيحٌ فٖيهَا عَذَابٌ اَلٖيمٌ ۙ ﴿٢٤﴾

---

(وَقَدْ خَلَتِ النُّذُرُ مِنْ بَيْنِ يَدَيْهِ وَمِنْ خَلْفِهٖٓ اَلَّا تَعْبُدُوٓا اِلَّا اللّٰهَ ۜ اِنّٖيٓ اَخَافُ عَلَيْكُمْ عَذَابَ يَوْمٍ عَظٖيمٍ) - (Ey Məhəmməd), **həqiqətən Huddan əvvəlki və sonrakı peyğəmbərlərin öz xalqlarını dəvət edib dediyi kimi Hud da öz xalqını dəvət edib, onlara dedi: "Ey xalq, Allah-Təaladan başqa heç bir şeyə ibadət etməyin, həqiqətən, mən çox şiddətli bir günün əzabı ilə sizə qorxuduram.**

**(*Qeyd:** *"Əhqaf hiqfin cəmidir, uzunsov, əyri-üyrü yüksək qum təpəsinə deyilir. Yəmən məmləkətində Ad camaatının yaşadığı məkanda çoxlu belə qum təpələri var idi. O səbəbdən həmin yerdə yaşayan xalqlar Əhqaf adı ilə adlandırıldı).*

**22) (قَالُوٓا اَجِئْتَنَا لِتَاْفِكَنَا عَنْ اٰلِهَتِنَاۚ)** - (Hudun cavabında) **dedilər:** (ey Hud), **sən bizə gəlibsən ki, bizi məbudlarımıza ibadət etməkdən döndərəsən? Biz sənin sözünü qəbul edib məbudlarımıza ibadət etməyi tərk edən deyilik.** (فَاْتِنَا بِمَا تَعِدُنَآ اِنْ كُنْتَ مِنَ الصَّادِقٖينَ) - **Əgər doğru deyənlərdənsənsə, o əzab ki, bizə vəd edirsən, gətir, qoy bizi yaxalayıb, həlak etsin.**

**23) (قَالَ اِنَّمَا الْعِلْمُ عِنْدَ اللّٰهِ) Hud öz xalqının cavabında dedi: "Əzabın gəlmə vaxtı haqqında bir bilgim yoxdur. Onun elmi Allah-Təalanın yanındadır. Nə vaxt sizə əzab göndərəcək, o özü bilir.**

**(وَاُبَلِّغُكُمْ مَآ اُرْسِلْتُ بِهٖ وَلٰكِنّٖيٓ اَرٰيكُمْ قَوْمًا تَجْهَلُونَ) - Mən ancaq Allah-Təala tərəfindən mənə göndərilən əmri (müvəhhid olub şirki tərk etməyi) sizə təbliğ edirəm. Lakin mən sizin özünüzü cahil kimi göstərən camaat olduğunuzu görürəm. Mənim sözümün haqq olduğunu bilib, amma özünüzü cahil kimi qələmə verirsiniz.** (Elə ki, Ad camaatı küfr və inadlarında israr etdilər, Allah-Təala onları qəhətliyə düçar etdi. Neçə illər yağış yağmadı. Elə ki, əzab vaxtı yaxınlaşdı. Havada bulud göründü. Elə xəyal etdilər ki, yağış yağdıran buludlardır. Şadlanıb fərəhləndilər. Lakin yağış yağdıracağını xəyal etdikləri buludlardan onlara əzab gəlib, hamısı həlak oldu. Necə ki, növbəti ayə xəbər verir).

**24) (فَلَمَّا رَاَوْهُ عَارِضًا مُسْتَقْبِلَ اَوْدِيَتِهِمْ) - Elə ki, səmada bulud göründü, Ad camaatı gördü ki, o bulud onların çöllərinə və iki dağlarının arasında olan əkin yerlərinə tərəf gəlir. (قَالُوا هٰذَا عَارِضٌ مُمْطِرُنَا) - Şadlıq edib bir-birilərinə dedilər: "Budur bulud gəlir, bizə yağış yağdırıb, qəhətlik əzabından xilas olacağıq, bu xəyalla yağışı gözlədilər".**

**(بَلْ هُوَ مَا اسْتَعْجَلْتُمْ بِهٖ ۜ رٖيحٌ فٖيهَا عَذَابٌ اَلٖيمٌ) -** (Allah-Təala onların gümanlarını boş

تُدَمِّرُ كُلَّ شَيْءٍ بِاَمْرِ رَبِّهَا فَاَصْبَحُوا لَا يُرٰىٓ اِلَّا مَسَاكِنُهُمْ ۗ كَذٰلِكَ نَجْزِي الْقَوْمَ الْمُجْرِمِينَ ﴿٢٥﴾
وَلَقَدْ مَكَّنَّاهُمْ فِيمَآ اِنْ مَكَّنَّاكُمْ فِيهِ وَجَعَلْنَا لَهُمْ سَمْعًا وَاَبْصَارًا وَاَفْئِدَةً ۘ فَمَآ اَغْنٰى عَنْهُمْ سَمْعُهُمْ
وَلَآ اَبْصَارُهُمْ وَلَآ اَفْئِدَتُهُمْ مِنْ شَيْءٍ اِذْ كَانُوا يَجْحَدُونَ بِاٰيَاتِ اللّٰهِ وَحَاقَ بِهِمْ مَا كَانُوا بِهٖ يَسْتَهْزِؤُنَ
﴿٢٦﴾ وَلَقَدْ اَهْلَكْنَا مَا حَوْلَكُمْ مِنَ الْقُرٰى وَصَرَّفْنَا الْاٰيَاتِ لَعَلَّهُمْ يَرْجِعُونَ ﴿٢٧﴾ فَلَوْلَا نَصَرَهُمُ
الَّذِينَ اتَّخَذُوا مِنْ دُونِ اللّٰهِ قُرْبَانًا اٰلِهَةً ۗ

---

çıxardıb, rədd edib deyir:) **o yağış buludu deyildir. Əksinə, tez gəlməsini istədiyiniz əzabdır. Bulud surətində əzab gətirən küləkdir, sizə gəlir, o küləkdə sizin üçün əziyyət verən əzab vardır.**

**25)** (تُدَمِّرُ كُلَّ شَيْءٍ بِاَمْرِ رَبِّهَا) **- O elə bir küləkdir ki, öz rəbbi Allah-Təalanın əmri ilə yetişdiyi hər bir şeyi həlak edər,** (O külək 7 gecə, 8 gün davam edib, hamısını həlak edib, məkan və mənzilləri boş qaldı).

(فَاَصْبَحُوا لَا يُرٰىٓ اِلَّا مَسَاكِنُهُمْ ۗ كَذٰلِكَ نَجْزِي الْقَوْمَ الْمُجْرِمِينَ) **- Ad camaatı hamısı həlak oldular. Ev və məskənlərindən başqa heç bir şey görünmədi.** (Ey Məhəmməd), **asi camaata Hud camaatı kimi cəza verib, həlak edərik.**

**26)** (وَلَقَدْ مَكَّنَّاهُمْ فِيمَآ اِنْ مَكَّنَّاكُمْ فِيهِ) **- Ey müşriklər, həqiqətən, o şeylərdə ki, Ad camaatına qüvvət və iqtidar verdik, siz müşriklərə elə qüvvət və iqtidar verməmişik. Onların bədənlərini sizdən qüvvətli, ömürlərini sizdən uzun, mallarını sizdən çox etdik. Amma bir fayda verməyib, onları əzabdan qorumadı.** (وَجَعَلْنَا لَهُمْ سَمْعًا وَاَبْصَارًا وَاَفْئِدَةً) **- Onlara qulaqlar, gözlər və qəlblər verdik ki, xeyir əməllərdə istifadə etsinlər. Lakin onlar nəfslərinə tabe olub, xəbis əməllər üçün istifadə edib, nemətə nankorluq etdilər.**

(فَمَآ اَغْنٰى عَنْهُمْ سَمْعُهُمْ وَلَآ اَبْصَارُهُمْ وَلَآ اَفْئِدَتُهُمْ مِنْ شَيْءٍ) **- Qulaqları, gözləri və qəlbləri ilə etdikləri xəbis əməllər onlara bir fayda verməyib, onları bizdən ehtiyacsız etmədi.** (اِذْ كَانُوا يَجْحَدُونَ بِاٰيَاتِ اللّٰهِ وَحَاقَ بِهِمْ مَا كَانُوا بِهٖ يَسْتَهْزِؤُنَ) **- O səbəbə görə ki, Allah-Təalanın ayələrini inkar edib istehza etdilər, istehza etdiklərinin cəzası onları sarıb, hamısı həlak oldu.**

**27)** (وَلَقَدْ اَهْلَكْنَا مَا حَوْلَكُمْ مِنَ الْقُرٰى وَصَرَّفْنَا الْاٰيَاتِ لَعَلَّهُمْ يَرْجِعُونَ) **- Ey Məkkə əhli, sizin ətrafınızda olan bölgələrin** (Həcər, Səmud və Sodom) **əhlini şirk səbəbi ilə həlak etdik. Həlak etmədən əvvəl biz tövhid və qüdrətimizə işarə edən dəlil və sübutları onlardan ötrü gətirib izhar etdik ki, bəlkə itaət edib şirki tərk edələr. Lakin tərk etməyib itaətə gəlmədilər və bu səbəbdən onları həlak etdik.**

**28)** (فَلَوْلَا نَصَرَهُمُ الَّذِينَ اتَّخَذُوا مِنْ دُونِ اللّٰهِ قُرْبَانًا اٰلِهَةً) - (Ey Məhəmməd), **həlak olan camaatların Allahdan başqa özlərinə məbud seçdikləri bütləri, hansı ki, onlara ibadət edirdilər ki, Allah-Təalaya yaxın olsunlar, niyə onlara**

بَلْ ضَلُّوا عَنْهُمْ ۚ وَذٰلِكَ اِفْكُهُمْ وَمَا كَانُوا يَفْتَرُونَ ﴿٢٨﴾ وَاِذْ صَرَفْنَٓا اِلَيْكَ نَفَرًا مِنَ الْجِنِّ يَسْتَمِعُونَ الْقُرْاٰنَ ۚ

---

**kömək etməyib bizim əzabımızdan onlara nicat vermədi? Bütlərə ibadət etmək əgər bizə yaxınlaşmağa səbəb olsaydı, hər halda onlara nicat verərdi. (بَلْ ضَلُّوا عَنْهُمْ ۚ وَذٰلِكَ اِفْكُهُمْ وَمَا كَانُوا يَفْتَرُونَ) - Əksinə, ehtiyac vaxtında bütlər onlardan kömək istəmədi, özlərindən yalan uydurub, bütləri məbud edib, Allah-Təalaya şərik qoşmaq iftira etməkdir.**

**29) (وَاِذْ صَرَفْنَٓا اِلَيْكَ نَفَرًا مِنَ الْجِنِّ يَسْتَمِعُونَ الْقُرْاٰنَ)** - (Ey Məhəmməd), **o zaman ki, cin tayfasından neçə şəxsləri* sənə tərəf qaytardıq, gəlib sənin** (Quran) **oxumağına qulaq asırdılar.**

**(*Qeyd:** *Təfsirçilər həmin ayənin təfsirində cin barəsində müxtəlif və uzun hədislər nəql edib, cinlərin müxtəlif surətlərə sahib olmaları haqda boş dəlillər gətirib, ayənin gəlməsi haqda yalan-palan, həqiqətdən uzaq sözlər deyiblər. Onların heç birini mən həqir yad etməyə layiq görməyib, çəkindim. Onlardan agah olmaq istəyənlər təfsir kitablarına, xüsusən "Xazin təfsiri"nə müraciət etsinlər, lakin diqqət üzrə fikir versinlər ki, necə o sözləri qəbul edib, kitablarda dərc edib, özlərindən sonra gələnlər üçün saxlayıblar. Uca peyğəmbər (ə.s) əmisi və himayəçisi Əbu Talib vəfat edəndən sonra Məkkədən çıxıb Taifə getdi ki, bəlkə orada onun dinini qəbul edib ona kömək olsunlar. Taif rəislərindən 3 qardaş (Ümeyr oğlanları Əbdi-Yəleyl, Məsud, Həbib) var idi. Allahın Rəsulu onları islama və yardım etməyə dəvət etdi. Onlar qəbul etmədi, Allahın Rəsulu da onlardan üz çevirdi. Lakin onlar Taifin cahil və nadanlarına peyğəmbərə əziyyət etməyi əmr etdilər. Cahillər Allahın Rəsulunu söyüb, vurmağa başladılar. Taifdə Məkkəli Qüreyş camaatından Rəbiənin Utbə və Şeybə adlı oğlanlarının bir bağı var idi. Özləri də həmin bağda idilər. Allahın Rəsulu pis adamlardan qaçıb, həmin bağa pənah aparıb daxil oldu. Camaat dağıldı. Allahın Rəsulu bir üzüm ağacının kölgəsində rahatlandı. Rəbiənin oğlanları o cənabın halətini görüb baxırdılar. Həyəcandan qeyrətə gəlib xristian olan Əddas adlı qulamı çağırıb bir qabın içinə bir neçə salxım üzüm qoyub dedilər: "Apar o şəxsə, de ki, bu üzümdən yesin". Əddas üzümü götürüb peyğəmbərin yanına qoyub dedi: "Yeyin". O cənab üzümdən götürüb, bismillah deyib yeyəndə Əddas peyğəmbərin üzünə baxıb dedi: "And olsun Allah-Təalaya, bu yerlərdə bu kəlməni deyən yoxdur. Allahın Rəsulu buyurdu: "Ey Əddas, hardansan və hansı dindənsən? Əddas dedi: xristian dinindənəm, Neynəva əhlindənəm. Allahın Rəsulu buyurdu: "Demək saleh bir insan olan Yunis ibn Məttanın həmyerlisisən? Əddas dedi: "Sən hardan bilirsən, Yunis kimdir? O cənab buyurdu: "O mənim qardaşımdır, o peyğəmbər idi, mən də peyğəmbərəm. Əddas peyğəmbərin başından, əlindən, ayağından öpdü. Bu zaman Rəbiə oğlanları da baxırdılar. Biri o birinə dedi: "Qulamı yoldan çıxartdı. Elə ki, Əddas qayıdıb onların yanına getdi. Dedilər: "Əddas, bu nə əməldi, səndən peyda oldu? O kişinin başından, əlindən, ayağından öpürdün. Əddas dedi: "Mənim ağala-*

فَلَمَّا حَضَرُوهُ قَالُوٓا اَنْصِتُواۚ فَلَمَّا قُضِيَ وَلَّوْا اِلٰى قَوْمِهِمْ مُنْذِرِينَ ﴿٢٩﴾ قَالُوا يَا قَوْمَنَٓا اِنَّا سَمِعْنَا
كِتَابًا اُنْزِلَ مِنْ بَعْدِ مُوسٰى مُصَدِّقًا لِمَا بَيْنَ يَدَيْهِ يَهْدِيٓ اِلَى الْحَقِّ وَاِلٰى طَرِيقٍ مُسْتَقِيمٍ ﴿٣٠﴾

---

*rım, yer üzündə bu kişidən yaxşı kişi yoxdur, mənə bir xəbər verdi ki, o xəbərdən peyğəmbərdən başqa heç bir şəxs agah ola bilməz. Dedilər: "Əddas, vay halına, sənin dinin onun dinindən yaxşıdır. Səni dinindən döndərməsin? Ondan sonra Allahın Rəsulu Taif əhlindən ümidini kəsib, Məkkəyə qayıdan vaxt Bətni-Nəxlə adlı yerdə bədəvi ərəblərdən bir camaatla qarşılaşdı. O cənab Quran oxuyarkən o camaatdan bəziləri gəlib onun ətrafına yığıldılar, Qurana qulaq asıb, imana daxil olub, ondan sonra gedib başqalarını da islama dəvət etdilər. Ola bilər ki, ayədəki cinlərdən məqsəd bu bədəvilərdir. Çünki cin kəlməsinin mənası örtülü bir şey deməkdir. Bədəvilər şəhərlilərdən uzaq olduğu üçün onlara cin deyilir. Həm də ana bətnində olan uşağa cənin (döl) deyilir. Eyni zamanda ünsiyyətli adamlara insan, insanlardan kənar, uzaq qaçanlara da cin deyilir və bu səbəbdən böyük şəhərlərdə yaşayanlara insan, ucqarlarda, səhralarda, çadır və alaçıqlarda yaşayanlara cin demək adətdir. Doğrudur, Qurani-Şərifin hökmü ilə oddan yaradılan cinlər insanlardan əvvəl yaşayan bir məxluq olublar. Lakin həmin tayfa indi də bu dünyada yaşayıb, mal və övlad sahibləridirlər. Lakin bizim gözlərimiz onları dərk etmir. Lakin cindarların dediyi kimi bizim evimizdə yanımızda yatan pərilərin bizimlə birlikdə yeyib-içməsi ağıldan və insanlıqdan uzaq bir işdir, bu, cini tutub, qamışın içinə salıb, naxoşlara şəfa verdiyini iddia edən xəbis dua yazanların mövhumat və xurafatlarıdır. Qurani-Şərifin ayələrini təfəkkür etmək lazımdır. Allah doğru yola hidayət edəndir).*

**(فَلَمَّا حَضَرُوهُ قَالُوٓا اَنْصِتُواۚ) - O zaman ki, Quran oxunanda hazır oldular, bir-birilərinə dedilər: "Sakit olub qulaq asın. (فَلَمَّا قُضِيَ وَلَّوْا اِلٰى قَوْمِهِمْ مُنْذِرِينَ) - Elə ki, sənin Quran oxumağın qurtardı, qövmlərini bizim əzabımızla qorxudub tövhidə dəvət edən bir halda öz qövmlərinə tərəf geri qayıtdılar.**

**30) (قَالُوا يَا قَوْمَنَٓا اِنَّا سَمِعْنَا كِتَابًا اُنْزِلَ مِنْ بَعْدِ مُوسٰى) - Ondan sonra həmin cinlər* qayıdıb öz qövmlərini dəvət edib dedilər: "Ey bizim qövm və camaatımız, həqiqətən, biz bir kitab eşitdik, hansı ki, Musadan sonra göndərilibdir".** (Onların İsanın adını çəkməyib, Musa demələri yəhudi olduqlarını göstərir, bu mətləb bizim cin barəsindəki araşdırmamıza böyük dəlildir).

**(مُصَدِّقًا لِمَا بَيْنَ يَدَيْهِ يَهْدِيٓ اِلَى الْحَقِّ وَاِلٰى طَرِيقٍ مُسْتَقِيمٍ) -Və özündən əvvəl gələn (Tövratı) təsdiq edib haqq və düz yola, tövhidə işarə edir.**

**(*Qeyd:** *"Əgər ayədə göstərilən cinləri həmin dua yazanların dediyi cinlərdən saysaq, gərək o vaxt onları bir neçə qrupa, tayfaya, məzhəbə bölək. Necə ki, "Nasixut-Təvarix" kitabının müəllifi cənab mirzə Tağı xan Lisanül-mülk kərtənkələləri ərəb tayfaları kimi bir neçə tayfaya bölübdür. Adı çəkilən kitabın Fatimeyi-Zəhra cildində deyir: "Bir bədəvi ərəb Mədinəyə varid olub peyğəmbəri*

يَا قَوْمَنَآ اَجِيبُوا دَاعِيَ اللّٰهِ وَاٰمِنُوا بِهٖ يَغْفِرْ لَكُمْ مِنْ ذُنُوبِكُمْ وَيُجِرْكُمْ مِنْ عَذَابٍ اَلِيمٍ ﴿٣١﴾ وَمَنْ لَا يُجِبْ دَاعِيَ اللّٰهِ فَلَيْسَ بِمُعْجِزٍ فِي الْاَرْضِ وَلَيْسَ لَهُ مِنْ دُونِهٖٓ اَوْلِيَآءُ اُولٰٓئِكَ فِي ضَلَالٍ مُبِينٍ ﴿٣٢﴾

---

*soruşdu, o cənabın evini nişan verdilər. Bədəvi o cənabın hüzuruna getdi, səhabələrdən də bəzisi orada idi. Bədəvi peyğəmbərdən soruşdu: "Nə deyib və nəyə dəvət edirsən? O cənab buyurdu: "Peyğəmbərəm, Allah-Təalanın birliyinə və şirki tərk etməyə dəvət edirəm. Bədəvi dedi: "Gərək bir möcüzə göstərəsən ki, haqlı olduğun mənə aşkar olsun. O cənab buyurdu: "Hər nə istəyirsən soruş. Bədəvi yanındakı böyük bir kərtənkələni – hansı ki, yeməkdən ötrü ovlamışdı, yerə saldı, dedi: "Əgər bu kərtənkələ danışıb, sənin peyğəmbərliyinə şəhadət etsə, o vaxt mən də iman edərəm. O cənab kərtənkələyə əmr edib buyurdu: "Ey kərtənkələ, Allah-Təalanın izni ilə danışıb, mənim peyğəmbərliyimə şəhadət et. Kərtənkələ bəlağətli ərəb dili ilə danışıb, tövhidə və o cənabın peyğəmbərliyinə şəhadət etdi. Bundan sonra cənab Lisanül-mülk buyurur: (və ənşədə əd-dəbbə) yəni kərtənkələ bəlağətli ərəb dilində bir qəsidə oxudu. Qəsidəni həmin kitabda nəql edir. Mən həqir o qəsidəni nəql etməkdən çəkindim. Qəsidənin misralarından biri budur ki, kərtənkələ deyir: "Biz Bəni-Səlim tayfası gərək cənaba təşəkkür edək". Müəllif əgər o kitabı yazmasaydı, kərtənkələlərin neçə qrup olmasını və o kərtənkələnin məhz Bəni-Səlim tayfasından olmağını biz bilməzdik. Müəllif bəlkə də istəyib desin ki, bədəvi bir qəsidə dedi, yalanı ortaya çıxmasın deyə kərtənkələ yazıb. Belə kitablar islam ümmətini aldadıb, cəhalətə salmır? Padşah tərəfindən belə bir adama hədiyyə və rütbə verilmişdi, guya həqiqətən, gözəl bir tarix yazıb, digər kitabları hökmsüz edib. Budur, bu da kitab. Müsəlmanlar gərək bəsirət gözlərini açıb, kitabların məzmununa dürüst diqqət etsinlər. Bəs belə kitabları oxumaq doğrudurmu? Ya da ki, belə kitablara pul verib evlərdə saxlamaq caizdirmi? Bu mətləbi ki, qeyd etdim, bu, bir nümunədir, bundan Lisanül-mülkün digər kitablarının da fəziləti məlum olur).*

**31) (يَا قَوْمَنَآ اَجِيبُوا دَاعِيَ اللّٰهِ) - cin deyir:) Ey bizim qövmümüz, Allah-Təalanın tərəfinə dəvət edib, çağıran şəxsin sözlərini qəbul edin.**

**(وَاٰمِنُوا بِهٖ يَغْفِرْ لَكُمْ مِنْ ذُنُوبِكُمْ وَيُجِرْكُمْ مِنْ عَذَابٍ اَلِيمٍ) - Allah-Təalaya iman edin ki, iman səbəbi ilə bəzi günahlarınızı (Allahın haqqı olanları) bağışlasın və sizi əzabdan qorusun.**

**32) (وَمَنْ لَا يُجِبْ دَاعِيَ اللّٰهِ فَلَيْسَ بِمُعْجِزٍ فِي الْاَرْضِ) - Və kim Allah-Təalanın dəvətçisini qəbul etməsə, yer üzündə Allah-Təalanı aciz edib, ondan qurtulan deyil ki, Allah-Təala ona əzab etməkdə aciz olsun.**

**(وَلَيْسَ لَهُ مِنْ دُونِهٖٓ اَوْلِيَآءُ اُولٰٓئِكَ فِي ضَلَالٍ مُبِينٍ) -Və o şəxsdən ötrü Allah-Təaladan başqa dostlar olmaz ki, Allahın əzabından onu qorusun, belə şəxslər açıq-aşkar zəlalət içindədirlər.** (Cinlərin sözü bitdi).

اَوَلَمْ يَرَوْا اَنَّ اللّٰهَ الَّذ۪ي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ وَلَمْ يَعْيَ بِخَلْقِهِنَّ بِقَادِرٍ عَلٰٓى اَنْ يُحْيِيَ الْمَوْتٰىۜ
بَلٰٓى اِنَّهُ عَلٰى كُلِّ شَيْءٍ قَد۪يرٌ ﴿٣٣﴾ وَيَوْمَ يُعْرَضُ الَّذ۪ينَ كَفَرُوا عَلَى النَّارِۜ اَلَيْسَ هٰذَا بِالْحَقِّۜ قَالُوا
بَلٰى وَرَبِّنَاۜ قَالَ فَذُوقُوا الْعَذَابَ بِمَا كُنْتُمْ تَكْفُرُونَ ﴿٣٤﴾ فَاصْبِرْ كَمَا صَبَرَ اُو۬لُوا الْعَزْمِ مِنَ الرُّسُلِ
وَلَا تَسْتَعْجِلْ لَهُمْۜ كَاَنَّهُمْ يَوْمَ يَرَوْنَ مَا يُوعَدُونَۙ لَمْ يَلْبَثُٓوا اِلَّا سَاعَةً مِنْ نَهَارٍۜ بَلَاغٌۚ فَهَلْ يُهْلَكُ اِلَّا
الْقَوْمُ الْفَاسِقُونَ ﴿٣٥﴾

---

**33) (اَوَلَمْ يَرَوْا اَنَّ اللّٰهَ الَّذ۪ي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ وَلَمْ يَعْيَ بِخَلْقِهِنَّ بِقَادِرٍ عَلٰٓى اَنْ يُحْيِيَ الْمَوْتٰىۜ)** - (Ey Məhəmməd), **qiyaməti inkar edənlər, bəs baxıb görmürlər ki, bir Allah-Təala ki, göyləri və yeri yaradıb, bu yaratma işində aciz olmaya, bəs belə mütləq qadir olan Allah-Təala ölüləri yenidən diriltməyə də qadirdir? (بَلٰٓى اِنَّهُ عَلٰى كُلِّ شَيْءٍ قَد۪يرٌ) - Əlbəttə, qadirdir, həqiqətən, Allah-Təala ölüləri diriltməklə birlikdə, hər bir şeyə də qadirdir.**

**34) (وَيَوْمَ يُعْرَضُ الَّذ۪ينَ كَفَرُوا عَلَى النَّارِۜ اَلَيْسَ هٰذَا بِالْحَقِّۜ) - Qiyamət günündə ki, kafir şəxslər əzab edilməkdən ötrü cəhənnəm oduna gətirildilər, o vaxt onlara deyilər: "Bəs bu əzab ki, peyğəmbərlər sizə dünyada vəd edirdilər, haqq olmadımı? (قَالُوا بَلٰى وَرَبِّنَاۜ) - Onlar cavabında deyərlər: "And olsun rəbbimiz Allah-Təalaya ki, bizə vəd edilən əzab haqq oldu.**

**(قَالَ فَذُوقُوا الْعَذَابَ بِمَا كُنْتُمْ تَكْفُرُونَ) - O vaxt Allah-Təala buyurar: "O səbəbə görə ki, Allah-Təalanın ayələrinə kafir olub müşrik oldunuz, indi inkar etdiyiniz əzabı dadın.**

**35) (فَاصْبِرْ كَمَا صَبَرَ اُو۬لُوا الْعَزْمِ مِنَ الرُّسُلِ وَلَا تَسْتَعْجِلْ لَهُمْ)** - (Ey Məhəmməd), **müşriklərin əziyyət etmələrinə səbir edib döz. Necə ki, səndən əvvəlki əzm və səbat sahibləri peyğəmbərlər səbir edib dözdülər. Daha onlardan ötrü əzab istəməkdə tələsmə, hər halda onlara əzab ediləcəkdir.**

**(كَاَنَّهُمْ يَوْمَ يَرَوْنَ مَا يُوعَدُونَۙ لَمْ يَلْبَثُٓوا اِلَّا سَاعَةً مِنْ نَهَارٍۜ) - O gündə ki,** (qiyamət günündə) **onlara vəd edilən əzabı gördülər, onlara elə gələr ki, dünyadakı uzun ömürləri sanki gündüz vaxtı keçən bir saatlıq vaxt kimi olub. (بَلَاغٌۚ)** - (Ey Məhəmməd), **bu öyüdlər ki, müşriklərə edilir, əgər qəbul etsələr, nəsihət olmaqda kifayət edər, (فَهَلْ يُهْلَكُ اِلَّا الْقَوْمُ الْفَاسِقُونَ) - öyüd-nəsihəti qəbul etməyən fasiq şəxslərdən başqası Allah-Təalanın əzabı ilə həlak olmaz.**

**Allaha həmd olsun, Əhqaf surəsinin təfsiri tamamlandı. Təfəkkür edənlərdən ötrü ibrətləri ehtiva edən ayələri olan mübarək surədir. Onun uca məzmununa diqqət edilsin. Allahın Rəsulu buyurubdur: "Kim Əhqaf surəsini oxusa, Allah-Təala onun üçün on xeyir yazar".**

# MƏHƏMMƏD SURƏSİ

47-ci surədir. Mədinədə nazil olub, 39 ayə, 593 kəlmə və 2349 hərfdir.

اَلَّذِينَ كَفَرُوا وَصَدُّوا عَنْ سَبِيلِ اللّٰهِ اَضَلَّ اَعْمَالَهُمْ ﴿١﴾ وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ وَاٰمَنُوا
بِمَا نُزِّلَ عَلٰى مُحَمَّدٍ وَهُوَ الْحَقُّ مِنْ رَبِّهِمْ كَفَّرَ عَنْهُمْ سَيِّاٰتِهِمْ وَاَصْلَحَ بَالَهُمْ ﴿٢﴾ ذٰلِكَ بِاَنَّ الَّذِينَ
كَفَرُوا اتَّبَعُوا الْبَاطِلَ وَاَنَّ الَّذِينَ اٰمَنُوا اتَّبَعُوا الْحَقَّ مِنْ رَبِّهِمْ كَذٰلِكَ يَضْرِبُ اللّٰهُ لِلنَّاسِ اَمْثَالَهُمْ ﴿٣﴾
فَاِذَا لَقِيتُمُ الَّذِينَ كَفَرُوا فَضَرْبَ الرِّقَابِ حَتّٰى اِذَٓا اَثْخَنْتُمُوهُمْ فَشُدُّوا الْوَثَاقَ

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (اَلَّذِينَ كَفَرُوا وَصَدُّوا عَنْ سَبِيلِ اللّٰهِ اَضَلَّ اَعْمَالَهُمْ) -** (Ey Məhəmməd), **o şəxslər ki, özləri küfr içində qalıb, islam dininə daxil olmayıb, xalqı da Allah-Təalanın yoluna** (islama) **daxil olmaqdan mane olub saxlayırlar, onların bu küfr və bu mane olmaları onların hər bir xeyir əməllərini batil və zay edib, o əməllərdən onlara heç bir fayda olmayacaqdır.**

**2) (وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ وَاٰمَنُوا بِمَا نُزِّلَ عَلٰى مُحَمَّدٍ وَهُوَ الْحَقُّ مِنْ رَبِّهِمْ) - Və o şəxslər ki, Allah-Təalaya iman edib, müvəhhid olub, gözəl əməllər edib, xüsusən Məhəmmədə rəbləri Allah-Təala tərəfindən haqq və doğru olaraq nazil olan Qurana iman edirlər, (كَفَّرَ عَنْهُمْ سَيِّاٰتِهِمْ وَاَصْلَحَ بَالَهُمْ) - O iman və əməl səbəbinə Allah-Təala onların günahlarını örtüb hal və işlərini islah edib, axirət işində onları müvəffəq, dünyada da düşmənlərinə üstün edib hakimiyyət bəxş edər.**

**3) (ذٰلِكَ بِاَنَّ الَّذِينَ كَفَرُوا اتَّبَعُوا الْبَاطِلَ وَاَنَّ الَّذِينَ اٰمَنُوا اتَّبَعُوا الْحَقَّ مِنْ رَبِّهِمْ) - Qeyd olunan kafirlərin əməllərini batil edib, möminlərin iş və hallarını dünya və axirətdə islah etmək o səbəbədir ki, kafirlər batilə və nəfslərinə tabe olub küfrü imana üstün saydılar. Lakin möminlər rəbləri Allah-Təaladan nazil olan haqqa** (Qurana) **tabe olub müvəhhid oldular.**

**(كَذٰلِكَ يَضْرِبُ اللّٰهُ لِلنَّاسِ اَمْثَالَهُمْ) - Allah-Təala xalqdan ötrü onların məsəllərini** (hallarını) **- kafirlərin batilə, möminlərin haqqa tabe olmalarını qeyd edir ki, ibrət alsınlar.**

**4) (فَاِذَا لَقِيتُمُ الَّذِينَ كَفَرُوا فَضَرْبَ الرِّقَابِ) - O zaman ki, siz möminlər cihad edərkən müşriklərlə qarşılaşdınız, onların boyunlarını vurub qətl edin. Cihad etməkdə sabit olun. (حَتّٰى اِذَٓا اَثْخَنْتُمُوهُمْ فَشُدُّوا الْوَثَاقَ) - Onları o vaxta qədər qətl edin ki, əksəriyyəti ölsün, o zaman da onların geridə qalanını**

فَاِمَّا مَنًّا بَعْدُ وَاِمَّا فِدَآءً حَتّٰى تَضَعَ الْحَرْبُ اَوْزَارَهَا ۚ ذٰلِكَ ۛ وَلَوْ يَشَآءُ اللّٰهُ لَانْتَصَرَ مِنْهُمْ ۙ وَلٰكِنْ لِيَبْلُوَا۟ بَعْضَكُمْ بِبَعْضٍ ۗ وَالَّذِينَ قُتِلُوا فِي سَبِيلِ اللّٰهِ فَلَنْ يُضِلَّ اَعْمَالَهُمْ ﴿٤﴾ سَيَهْدِيهِمْ وَيُصْلِحُ بَالَهُمْ ۚ ﴿٥﴾ وَيُدْخِلُهُمُ الْجَنَّةَ عَرَّفَهَا لَهُمْ ﴿٦﴾ يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا اِنْ تَنْصُرُوا اللّٰهَ يَنْصُرْكُمْ وَيُثَبِّتْ اَقْدَامَكُمْ ﴿٧﴾

---

**əsir edib, möhkəm bağlayın ki, qaçmasınlar. Əksəriyyətini qətl etməmiş digərlərini əsir etməyin. (فَاِمَّا مَنًّا بَعْدُ وَاِمَّا فِدَآءً حَتّٰى تَضَعَ الْحَرْبُ اَوْزَارَهَا) - Müşrikləri əsir edəndən sonra ya yaxşılıq edib, əvəz almadan onları azad edin, ya da ki, əvəz alıb azad edin. Bu barədə sizə ixtiyar verildi. Nə qədər ki savaş var, sizdən ötrü müşrikləri qətl etmək, qətldən sonra qalanlarını əsir edib əvəz almadan, ya da əvəz alaraq azad etmək ixtiyarı vardır. Elə ki, sizinlə savaşanlar silahlarını atıb, savaşmaqdan imtina etdilər, o vaxt daha sizin nə qətl etmək, nə də əsir etmək ixtiyarınız yoxdur.**

**(ذٰلِكَ ۛ وَلَوْ يَشَآءُ اللّٰهُ لَانْتَصَرَ مِنْهُمْ ۙ وَلٰكِنْ لِيَبْلُوَا۟ بَعْضَكُمْ بِبَعْضٍ) - Kafirlər barəsində hökm budur, hərb olanda gərək onlarla cihad edəsiniz, əgər Allah-Təala istəsə cihaddan başqa bir yol ilə də onlardan intiqam alıb, onları həlak edər, lakin Allah-Təala sizə cihadı əmr etdi. Belə ki, siz möminləri kafirlərə və kafirləri sizə mübtəla edib, sizə savab verib, onlara əzab etsin.**

**(وَالَّذِينَ قُتِلُوا فِي سَبِيلِ اللّٰهِ فَلَنْ يُضِلَّ اَعْمَالَهُمْ) - O şəxslər ki, Allah-Təala yolunda cihad edib, şəhid ola, onların əməlləri zay olmayıb, əcr-savabları gözəl vəchlə onlara yetişəcəkdir.**

**5) (سَيَهْدِيهِمْ وَيُصْلِحُ بَالَهُمْ) - Cihad edənləri Allah-Təala dünyada haqq tərəfinə hidayət edib, hal və işlərini elə islah edər ki, onlardan xeyir əməllər peyda olar.**

**6) (وَيُدْخِلُهُمُ الْجَنَّةَ عَرَّفَهَا لَهُمْ) - Axirətdə də onları cənnətə daxil edib, cənnətdəki mənzillərini Allah-Təala özü onlara elə tanıtdırar ki, sanki həmişə orada yaşamışlar kimi göstərilmədən gedib, evlərinə daxil olarlar.**

**7) (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا اِنْ تَنْصُرُوا اللّٰهَ يَنْصُرْكُمْ وَيُثَبِّتْ اَقْدَامَكُمْ) - Ey möminlər, əgər siz* Allah-Təalanın dininə və peyğəmbərinə kömək edib, islam dinini ucaltsanız, Allah-Təala da sizə kömək edib, sizi düşmənə qalib edib, islam yolunda sizin qədəmlərinizi sabit və bərqərar edər.**

**(*Qeyd:** *"Bu ayə müsəlmanları islamı ucaldıb kömək etməyə həvəsləndirib, dəvət edir. Yəni Allah-Təalanın yardımı o şəxsə aid olar ki, islamın qələbəsi üçün çalışıb, gücü çatan qədər yardım edib, köməyini əsirgəməsin. Malı ilə, canı ilə, dili ilə, ya da ki, qələmi ilə gərək kömək etsin, bir şəxs ki, imkanı olduğu halda köməyini əsirgəsə, o şəxs islamdan xaric sayılar. İslamın ilk illərində yaşayan müsəlmanlar islamın həqiqətini dərk edib, ona yardım etdilər. Onlardan sonra müsəlmanların*

وَالَّذِينَ كَفَرُوا فَتَعْسًا لَهُمْ وَاَضَلَّ اَعْمَالَهُمْ ﴿٨﴾ ذٰلِكَ بِاَنَّهُمْ كَرِهُوا مَٓا اَنْزَلَ اللّٰهُ فَاَحْبَطَ اَعْمَالَهُمْ ﴿٩﴾
اَفَلَمْ يَسِيرُوا فِي الْاَرْضِ فَيَنْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الَّذِينَ مِنْ قَبْلِهِمْ ۜ دَمَّرَ اللّٰهُ عَلَيْهِمْ ۘ وَلِلْكَافِرِينَ
اَمْثَالُهَا ﴿١٠﴾ ذٰلِكَ بِاَنَّ اللّٰهَ مَوْلَى الَّذِينَ اٰمَنُوا وَاَنَّ الْكَافِرِينَ لَا مَوْلٰى لَهُمْ ۟ ﴿١١﴾ اِنَّ اللّٰهَ يُدْخِلُ
الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ ۜ وَالَّذِينَ كَفَرُوا يَتَمَتَّعُونَ وَيَاْكُلُونَ
كَمَا تَاْكُلُ الْاَنْعَامُ وَالنَّارُ مَثْوًى لَهُمْ ﴿١٢﴾

---

*arasında ixtilaf çıxıb, o zamandan bəri müsəlmanlar islamın həqiqətini itirib, bir-birini təkfir edib, hər qrup, bəlkə hər bir şəxs özündən ötrü bir yol seçib, islama yardım etməyi unutdular və bu səbəbdən onların arasında ixtilaf peyda olub, Allah-Təalanın və Allah Rəsulunun rəyi dura-dura, özləri rəy verib, hətta öz rəyləri ilə şəriət sahibinin rəyini hökmsüz etdilər. Bundan sonra əsl qanuni din və məzhəb salamat qalarmı?)*

**8) (وَالَّذِينَ كَفَرُوا فَتَعْسًا لَهُمْ وَاَضَلَّ اَعْمَالَهُمْ) - O şəxslər ki, islama kafir olub küfr və şirklərində qaldılar, onlar qətl və həlak olsun. Allah-Təala onların əməllərini onlardan yox edib, batil edər.**

**9) (ذٰلِكَ بِاَنَّهُمْ كَرِهُوا مَٓا اَنْزَلَ اللّٰهُ فَاَحْبَطَ اَعْمَالَهُمْ) - Kafir və müşriklərin qətl edilməsi və əməllərinin batil olması o səbəbdəndir ki, Allah-Təalanın göndərdiyi Quranı rədd etdilər. Allah-Təala da onların əməllərini batil etdi.**

**10) (اَفَلَمْ يَسِيرُوا فِي الْاَرْضِ فَيَنْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الَّذِينَ مِنْ قَبْلِهِمْ ۜ دَمَّرَ اللّٰهُ عَلَيْهِمْ)** - (Ey Məhəmməd), **bəs müşriklər yer üzünü seyr edib səfərə getmirlər ki, onlardan əvvəlki ümmətlərin əsərlərinə baxıb görsünlər ki, onların aqibətləri necə oldu? Allah-Təala onlara məxsus olan hər bir şeyi - nəfslərini, mal və övladlarını, hamısını həlak etdi. (وَلِلْكَافِرِينَ اَمْثَالُهَا)** - (Ey Məhəmməd), **sənə kafir olanlar əgər tövbə edib iman etməsələr, bəhs olunan fəlakətlərin bənzərlərindən onlar üçün də vardır. Əzabımız onları tutub, xilas ola bilməyəcəklər.**

**11) (ذٰلِكَ بِاَنَّ اللّٰهَ مَوْلَى الَّذِينَ اٰمَنُوا وَاَنَّ الْكَافِرِينَ لَا مَوْلٰى لَهُمْ) - Kafirlərə ölüm və əzabın varid olması o səbəbdəndir ki, həqiqətən, Allah-Təala möminlərin dostu və köməyidir. Həqiqətən, kafirlərdən ötrü bir dost və bir kömək yoxdur ki, əzabı onlardan saxlayıb, nicat tapsınlar.**

**12) (اِنَّ اللّٰهَ يُدْخِلُ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ) -Həqiqətən, Allah-Təala iman edib, xeyir əməl edənləri ağaclarının və qəsrlərinin altından çaylar axan cənnətlərə daxil edər.**

**(وَالَّذِينَ كَفَرُوا يَتَمَتَّعُونَ وَيَاْكُلُونَ كَمَا تَاْكُلُ الْاَنْعَامُ وَالنَّارُ مَثْوًى لَهُمْ) - Amma kafirlər dünyada bir neçə gün ləzzət alıb,** (dəvə) **otlaqda hər bir şeydən xəbərsiz ot yeməklə məşğul olduğu kimi, kafirlər də təfəkkür etmədən Allah-Təalanın**

وَكَاَيِّنْ مِنْ قَرْيَةٍ هِيَ اَشَدُّ قُوَّةً مِنْ قَرْيَتِكَ الَّتِيٓ اَخْرَجَتْكَۚ اَهْلَكْنَاهُمْ فَلَا نَاصِرَ لَهُمْ ﴿١٣﴾ اَفَمَنْ
كَانَ عَلٰى بَيِّنَةٍ مِنْ رَبِّهٖ كَمَنْ زُيِّنَ لَهُ سُوٓءُ عَمَلِهٖ وَاتَّبَعُوٓا اَهْوَآءَهُمْ ﴿١٤﴾ مَثَلُ الْجَنَّةِ الَّتِي وُعِدَ
الْمُتَّقُونَۜ فِيهَآ اَنْهَارٌ مِنْ مَآءٍ غَيْرِ اٰسِنٍۚ وَاَنْهَارٌ مِنْ لَبَنٍ لَمْ يَتَغَيَّرْ طَعْمُهُۚ وَاَنْهَارٌ مِنْ خَمْرٍ لَذَّةٍ لِلشَّارِبٖينَ
ۚ وَاَنْهَارٌ مِنْ عَسَلٍ مُصَفًّىۜ وَلَهُمْ فٖيهَا مِنْ كُلِّ الثَّمَرَاتِ وَمَغْفِرَةٌ مِنْ رَبِّهِمْۜ كَمَنْ هُوَ خَالِدٌ فِي النَّارِ
وَسُقُوا مَآءً حَمٖيمًا فَقَطَّعَ اَمْعَآءَهُمْ ﴿١٥﴾

---

**nemətlərini yeyib, yaradılışdan və axirətdən qafil olarlar. Elə ki, dünyadan köçdülər, cəhənnəmin odu onların mənzil və məqamı olacaqdır.**

**13) (وَكَاَيِّنْ مِنْ قَرْيَةٍ هِيَ اَشَدُّ قُوَّةً مِنْ قَرْيَتِكَ الَّتِيٓ اَخْرَجَتْكَۚ اَهْلَكْنَاهُمْ فَلَا نَاصِرَ لَهُمْ)** - (Ey Məhəmməd), **səndən əvvəlki şəhərlərin əhli səni öz aralarından çıxaran Məkkə əhlindən qüvvət və qüdrətdə daha qüvvətli və möhkəm idilər. Bizə asi olmaq səbəbi ilə onları həlak etdik, kömək edənləri də olmadı ki, əzabı onlardan dəf etsin, Məkkə əhli onlardan daha zəifdir. Əlbəttə, onları da həlak etməyə qadirik.** (Ayə örtülü şəkildə Allahın Rəsuluna Məkkə əhlinə qalib olacağı müjdəsini verir).

**14) (اَفَمَنْ كَانَ عَلٰى بَيِّنَةٍ مِنْ رَبِّهٖ كَمَنْ زُيِّنَ لَهُ سُوٓءُ عَمَلِهٖ وَاتَّبَعُوٓا اَهْوَآءَهُمْ)** - (Ey Məhəmməd), **bəs o şəxs ki, öz rəbbi Allah-Təaladan olan dəlil və sübutla Qurani-Şərifin həqiqətini dərk edib, Allah-Təalaya** (və Məhəmmədə) **iman edir, görəsən belə şəxs o şəxslər kimidir ki, pis əməlləri onlara gözəl göstərilib, nəfslərinə tabe olub, Allah-Təalaya şərik qoşub, bütə sitayiş edə? Əlbəttə bərabər olmazlar. Müşriklə müvəhhid necə bərabər olar?**

**15) (مَثَلُ الْجَنَّةِ الَّتِي وُعِدَ الْمُتَّقُونَۜ فِيهَآ اَنْهَارٌ مِنْ مَآءٍ غَيْرِ اٰسِنٍۚ)** - (Ey Məhəmməd), **müttəqilərə vəd et ki, cənnətin məsəli və xüsusiyyəti budur ki, bəhs olunur, o cənnətdə suyunun rəngi və ətri dəyişməyən çaylar axar.**

**(وَاَنْهَارٌ مِنْ لَبَنٍ لَمْ يَتَغَيَّرْ طَعْمُهُ) - Habelə südünün dadı dəyişməyən çaylar vardır. (وَاَنْهَارٌ مِنْ خَمْرٍ لَذَّةٍ لِلشَّارِبٖينَ) -Və habelə içənlərdən ötrü ləzzətli olan, ağlı zay və sərxoş etməyən şərabdan çaylar vardır.**

**(وَاَنْهَارٌ مِنْ عَسَلٍ مُصَفًّى) - Və habelə arı bətnindən çıxmayan mum və qeyri-mumdan saf və xalis baldan çaylar vardır.**

**(وَلَهُمْ فٖيهَا مِنْ كُلِّ الثَّمَرَاتِ وَمَغْفِرَةٌ مِنْ رَبِّهِمْ) - Bundan əlavə möminlərdən ötrü rəbləri Allah-Təala tərəfindən bağışlanmaq və hər bir möv meyvələr hazır və mövcuddur. (كَمَنْ هُوَ خَالِدٌ فِي النَّارِ وَسُقُوا مَآءً حَمٖيمًا فَقَطَّعَ اَمْعَآءَهُمْ) - Bəs bəhs olunan cənnət əhli müttəqilər o şəxs kimidirlər ki, cəhənnəm odunda həmişə olub, şiddətli qaynar su onlara içizdirilib, bağırsaqlarını parça-parça edib, oradan da çıxa? Əlbəttə, cənnət əhli belə bəla və əzab əhli ilə bərabər olmazlar.**

وَمِنْهُمْ مَنْ يَسْتَمِعُ اِلَيْكَۚ حَتّٰٓى اِذَا خَرَجُوا مِنْ عِنْدِكَ قَالُوا لِلَّذٖينَ اُو۫تُوا الْعِلْمَ مَاذَا قَالَ اٰنِفًا۠ اُو۬لٰٓئِكَ الَّذٖينَ طَبَعَ اللّٰهُ عَلٰى قُلُوبِهِمْ وَاتَّبَعُوٓا اَهْوَٓاءَهُمْ ﴿١٦﴾ وَالَّذٖينَ اهْتَدَوْا زَادَهُمْ هُدًى وَاٰتٰيهُمْ تَقْوٰيهُمْ ﴿١٧﴾ فَهَلْ يَنْظُرُونَ اِلَّا السَّاعَةَ اَنْ تَأْتِيَهُمْ بَغْتَةًۚ فَقَدْ جَٓاءَ اَشْرَاطُهَاۚ فَاَنّٰى لَهُمْ اِذَا جَٓاءَتْهُمْ ذِكْرٰيهُمْ ﴿١٨﴾

---

**16) (وَمِنْهُمْ مَنْ يَسْتَمِعُ اِلَيْكَۚ حَتّٰٓى اِذَا خَرَجُوا مِنْ عِنْدِكَ قَالُوا لِلَّذٖينَ اُو۫تُوا الْعِلْمَ مَاذَا قَالَ اٰنِفًا۠)** - (Ey Məhəmməd), **münafiqlərdən bəzi şəxslər vardır ki, sənin məclisində hazır olub, sənin sözlərinə qulaq asıb eşidirlər, elə ki, sənin məclisindən çıxdıar,** (istehza etmək üçün) **Quran elminə sahib olanlara** (sənin səhabələrinə) **deyərlər: "İndi** (Məhəmməd) **nə dedi və nə danışdı? Bizə də deyin, biz onun sözlərini unutduq."**

**(اُو۬لٰٓئِكَ الَّذٖينَ طَبَعَ اللّٰهُ عَلٰى قُلُوبِهِمْ وَاتَّبَعُوٓا اَهْوَٓاءَهُمْ) - Bu münafiqlər o şəxslərdir ki, nifaqlarına görə Allah-Təala onların qəlblərinə elə bir möhür vurubdur ki, nəfslərinə tabe olub, haqq sözləri dərk edə bilməzlər. Hərçənd onlar istehza etmək üçün deyirdilər:** (Məhəmməd nə dedi? Biz onun sözlərini unutduq), **lakin həqiqətən, onlar haqq sözü anlamayıb, dərk edə bilməzlər.**

**17) (وَالَّذٖينَ اهْتَدَوْا زَادَهُمْ هُدًى وَاٰتٰيهُمْ تَقْوٰيهُمْ) - O şəxslər ki, hidayət tapıb haqqa tabe oldular, Allah-Təala onlara kömək etməklə onların hidayətini artırıb, təqvalarına yardım edib, kamil mömin oldular.**

**18) (فَهَلْ يَنْظُرُونَ اِلَّا السَّاعَةَ اَنْ تَأْتِيَهُمْ بَغْتَةًۚ فَقَدْ جَٓاءَ اَشْرَاطُهَاۚ)** - (Ey Məhəmməd), **kafirlər və münafiqlər qiyamətin dərhal vaqe olmasını gözləyirlər? Halbuki qiyamətin vaqe olma əlamətləri onlara gəldi, hələ də diqqət etmirlər?** (Ey Məhəmməd), **Allah-Təala sənə ehkam verib, səni peyğəmbər göndərdi, sənin göndərilmənlə* aləmdə böyük bir inqilab oldu, bununla belə yenə qiyaməti inkar edirlər.**

**(*Qeyd:** *"Mövlana Cəlaləddin Rumi Muzzəmmil surəsinin təfsirində guya Allah-Təalanın peyğəmbərə belə xitab etdiyini buyurur:*

*"Çünki sən vaxtın İsrafilisən, dərhal dur qiyamətdən qabaq bir qiyamət qopar. Haradadır bu qiyamət? deyib soruşana özünü göstər. "Budur qiyamət mənəm.""*

*Hərçənd Mövlana bu beyti Muzzəmmil surəsinin təfsirində bəyan buyurur, lakin bu ayədə də eyni məzmundur. Anlayın və təfəkkür edin).*

**(فَاَنّٰى لَهُمْ اِذَا جَٓاءَتْهُمْ ذِكْرٰيهُمْ) - O zaman ki, qiyamət qəfildən onlara gəldi, onların agah olub, nəsihət qəbul edib, tövbə etmələri necə mümkün olar? O zaman tövbə vaxtı keçib, daha onlara fürsət verilməz.**

فَاعْلَمْ اَنَّهُ لَآ اِلٰهَ اِلَّا اللّٰهُ وَاسْتَغْفِرْ لِذَنْبِكَ وَلِلْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ وَاللّٰهُ يَعْلَمُ مُتَقَلَّبَكُمْ وَمَثْوٰيكُمْ ﴿١٩﴾
وَيَقُولُ الَّذٖينَ اٰمَنُوا لَوْلَا نُزِّلَتْ سُورَةٌ فَاِذَآ اُنْزِلَتْ سُورَةٌ مُحْكَمَةٌ وَذُكِرَ فٖيهَا الْقِتَالُ رَاَيْتَ الَّذٖينَ فٖي
قُلُوبِهِمْ مَرَضٌ يَنْظُرُونَ اِلَيْكَ نَظَرَ الْمَغْشِيِّ عَلَيْهِ مِنَ الْمَوْتِ فَاَوْلٰى لَهُمْ ﴿٢٠﴾ طَاعَةٌ وَقَوْلٌ مَعْرُوفٌ
فَاِذَا عَزَمَ الْاَمْرُ فَلَوْ صَدَقُوا اللّٰهَ لَكَانَ خَيْرًا لَهُمْ ﴿٢١﴾ فَهَلْ عَسَيْتُمْ اِنْ تَوَلَّيْتُمْ اَنْ تُفْسِدُوا فِي الْاَرْضِ
وَتُقَطِّعُوٓا اَرْحَامَكُمْ ﴿٢٢﴾ اُولٰٓئِكَ الَّذٖينَ لَعَنَهُمُ اللّٰهُ فَاَصَمَّهُمْ وَاَعْمٰٓى اَبْصَارَهُمْ ﴿٢٣﴾ اَفَلَا يَتَدَبَّرُونَ
الْقُرْاٰنَ اَمْ عَلٰى قُلُوبٍ اَقْفَالُهَا ﴿٢٤﴾

---

**19) (فَاعْلَمْ اَنَّهُ لَآ اِلٰهَ اِلَّا اللّٰهُ وَاسْتَغْفِرْ لِذَنْبِكَ وَلِلْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ) -** (Ey Məhəmməd), **o zaman ki, kafirlərin zillətinə, möminlərin səadətinə agah oldunuz, bilin ki, həqiqətən, yeganə Allah-Təaladan başqa haqq məbud yoxdur. Təvazönü özünüzə şüar edib sənin və sənə tabe olan möminlərin günahlarının əfv edilməsini istə. (وَاللّٰهُ يَعْلَمُ مُتَقَلَّبَكُمْ وَمَثْوٰيكُمْ) - Sizin əhvalınıza və hər bir işi necə görmənizə, məişət və ticarətdəki davranışlarınıza, evlərinizdə rahat olub dinlənmənizə, hamısına Allah-Təala agahdır. Əlbəttə, belə Allah-Təaladan qorxub, ona sitayiş etmək layiqdir.**

**20) (وَيَقُولُ الَّذٖينَ اٰمَنُوا لَوْلَا نُزِّلَتْ سُورَةٌ) -** (Ey Məhəmməd), **möminlər cihad barəsində sual verib dedilər: "Nədən ötrü elə bir surə nazil olmur ki, bizə cihadı əmr etsin". (فَاِذَآ اُنْزِلَتْ سُورَةٌ مُحْكَمَةٌ وَذُكِرَ فٖيهَا الْقِتَالُ) -** (Ey Məhəmməd), **o zaman ki, mənası açıq-aşkar olub, başqa heç bir mənası olmayan cihad barəsində bir surə nazil olub, orada cihad etmək qeyd olunub, cihadla məsul oldular, (رَاَيْتَ الَّذٖينَ فٖي قُلُوبِهِمْ مَرَضٌ يَنْظُرُونَ اِلَيْكَ نَظَرَ الْمَغْشِيِّ عَلَيْهِ مِنَ الْمَوْتِ) - O vaxt da qəlblərində nifaq xəstəliyi olan şəxsləri görərsən ki, ölüm qorxusundan bayılan şəxslər kimi qorxularından gözləri axıb, sənə baxarlar. Sanki ölüm dərhal onlara gələcəkdir. (فَاَوْلٰى لَهُمْ) Heç vaxt Allah-Təalanın kəlamına inanmırlar, ölüm və əzaba yaxın olsunlar.**

**21) (طَاعَةٌ وَقَوْلٌ مَعْرُوفٌ) - Allah-Təalanın əmrlərinə itaət edib, gözəl danışmaq itaətsizlikdən və boş söz danışmaqdan yaxşıdır.**

**(فَاِذَا عَزَمَ الْاَمْرُ فَلَوْ صَدَقُوا اللّٰهَ لَكَانَ خَيْرًا لَهُمْ) - O zaman ki, cihad əmri qəti olub, cihad etmək onlara fərz oldu, əgər o vaxt Allah-Təalaya itaət və iman edib, cihada əzm etsələr, hər halda bu, onlardan ötrü yaxşıdır.**

**22) (فَهَلْ عَسَيْتُمْ اِنْ تَوَلَّيْتُمْ اَنْ تُفْسِدُوا فِي الْاَرْضِ وَتُقَطِّعُوٓا اَرْحَامَكُمْ) - ümid edirsiniz ki, xalqın işlərinə rəhbər olasanız, o vaxt da fəsad edib xalqa* zülm edib, xüsusilə qohumlarla əlaqəni kəsəsiniz?**

**23) (اُولٰٓئِكَ الَّذٖينَ لَعَنَهُمُ اللّٰهُ فَاَصَمَّهُمْ وَاَعْمٰٓى اَبْصَارَهُمْ) - Bu qeyd olunan münafiqlərə Allah-Təala lənət edib, qulaqlarını haqqı eşitməkdən kar və gözlərini haqqı görməkdən kor edibdir.**

**24) (اَفَلَا يَتَدَبَّرُونَ الْقُرْاٰنَ اَمْ عَلٰى قُلُوبٍ اَقْفَالُهَا) - Bəs münafiqlər Quranın açıq-ay-**

**dın ayələrini təfəkkür etmirlər ki, onun qadağalarını və nəsihətlərini dərk edib, Allah-Təalaya asi olmağa cəsarət etməsinlər? Ya da ki, qəlblərinə küfr, nifaq qıfılı vurulub, Quranın ehkamı onların qəlblərinə yetişməyib, dərk etmirlər?**

**(*Qeyd:** *"Allah-Təala bu ayədə gözəl şəkildə hakim və rəislərə zülm və əziyyət etməyi qadağan edib, ədaləti, insaf və mürüvvəti əmr edir. Hər bir rəis gərək öz işlərində Allahın Rəsuluna tabe olub, insanpərvər, şəfqətli və təvazökar olub, özünü xalq ilə eyni görüb, insanlara qarşı təkəbbürlü olmamaqda gərək uca peyğəmbərdən nümunə götürsünlər. Nəinki adlarını müsəlman qoyub, lakin hər bir işlərində firon və şəddada tabe olub, zülmü özlərinə şüar etsinlər. Uca peyğəmbərin şəfqəti, təvazökarlığı elə bir səviyyədə idi ki, məclisində özündən ötrü bir xüsusi bir məqam təyin etməmişdi. Onu tanımayıb məclisə daxil olan şəxs məclisə baxıb, soruşardı ki, Allahın Rəsulu kimdir? Lakin islam ümmətinin nəinki siyasi rəisləri, hətta ruhani rəisləri də haqları olmadan xalqın özlərinə itaətini vacib sayıb, əllərini öpdürməyi, əllərinin dəstəmaz suyunu xalqa dərman deyib, onları hüzurlarında səf-səf durdurmaqdan həzz alırlar. Əmirəl-möminin Əli ibn Əbu Talib Sıffin savaşına gedərkən yol əsnasında o kəndlərin əhalisi o cənabı qarşılamağa çıxıb, ta qədimdən İran təbəəsi olub hakimlərə hörmət etdikləri şəkildə əllərini sinələrinə qoyub, səf-səf durub, o cənabı gözləməyə başladılar. O cənab onlara yaxınlaşanda, onlar adətlərinə görə rüku edər kimi əyilib, təzim edib o cənabı salamladılar. O cənab onlardan soruşdu ki, siz niyə belə edirsiniz? Ərz etdilər ki, ya əmirəl-möminin, padşah və əmirlərə belə təzim etmək bizim adətimizdir. O cənab buyurdu: "Nə pis adətdir. İslam bunları ləğv etdi. Belə xəbis adətlər islamda caiz deyildir. Əmirəl-mömininі özlərinə rəis seçən müsəlmanlar əmirəl-mömininin haram saydığı xəbis xüsusiyyətləri özlərinə şüar edib, indi də həmin qayda ilə rəftar edirlər. Bununla belə islamın tərəqqisi haqqında riyakarcasına danışırlar. Din və ümmətin tərəqqisi əmirəl-mömininin yoluna tabe olmaqla olar. Nəinki nəfsə tabe olmaqla. İslam ümmətinin ilk rəislərinin hansı əməlinə biz tabe olmuşuq? Bizim aramızda işlənən adətlərin hamısı bidət və zəlalət, nəfsani arzularla edilən əməllərdir. Şəriətin qadağan və haram etdiyi şeyləri edib, adlarını islamın himayəçisi qoyanlara islam düşməni demək daha layiqdir. Əksinə islamın himayəçiləri (necə ki, islamın ilk dövründə olub) fərz və savab iş görməyi özlərinə vacib sayıb, səcdənin çoxluğundan alınları qabar bağlayanlar olubdur. Lakin bizim bu zəmanədə islamın qanun və ehkamından əsla xəbərləri olmayıb, lakin xarici dildə bəzi məişət işlərinə dair elmlərdən təhsil alıb, gecələri sərxoşluqla, gündüzləri də onun süstlüyü ilə keçirib, şəriətin haram saydıqlarını edənlər özlərinə islamın himayəçisi adını veriblər. Eyvah, belə islam himayəçisi olar? ərəbcə şeir Əbu Hənifə xalqı gizlincə Zeyd ibn Əli ibnül-Hüseynə itaət etməyə və Abbasi xəlifəsi Mənsuru taxtdan salmağa dəvət edib deyirdi: "Mənsur zalımdır, islama görə zalıma itaət vacib deyildir. II xəlifə Ömər ibn Xəttab minbərdə xütbə edərkən buyurdu: "Ey müsəlmanlar, nə qədər ki, mən Allah-Təalanın itaətində sabit və bərqəraram, mənə itaət etmək sizə lazımdır, elə ki, mən Allah-Təalaya asi*

اِنَّ الَّذِينَ ارْتَدُّوا عَلٰى اَدْبَارِهِمْ مِنْ بَعْدِ مَا تَبَيَّنَ لَهُمُ الْهُدَى الشَّيْطَانُ سَوَّلَ لَهُمْ وَاَمْلٰى لَهُمْ
﴿٢٥﴾ ذٰلِكَ بِاَنَّهُمْ قَالُوا لِلَّذِينَ كَرِهُوا مَا نَزَّلَ اللّٰهُ سَنُطِيعُكُمْ فِي بَعْضِ الْاَمْرِ وَاللّٰهُ يَعْلَمُ اِسْرَارَهُمْ
﴿٢٦﴾ فَكَيْفَ اِذَا تَوَفَّتْهُمُ الْمَلٰئِكَةُ يَضْرِبُونَ وُجُوهَهُمْ وَاَدْبَارَهُمْ ﴿٢٧﴾ ذٰلِكَ بِاَنَّهُمُ اتَّبَعُوا مَٓا
اَسْخَطَ اللّٰهَ وَكَرِهُوا رِضْوَانَهُ فَاَحْبَطَ اَعْمَالَهُمْ ﴿٢٨﴾ اَمْ حَسِبَ الَّذِينَ فِي قُلُوبِهِمْ مَرَضٌ اَنْ لَنْ
يُخْرِجَ اللّٰهُ اَضْغَانَهُمْ ﴿٢٩﴾

---

*oldum, o vaxt mənə itaət etmək sizə lazım deyildir. Yəni zalım şəxsə itaət etmək haramdır. İslam ümməti qəflət yuxusuna dalıb, islamın ehkam və qanunundan bixəbər qalıblar. Hər halda gərək öz hallarını və rəislərinə itaət etmənin lazım olub-olmadığını düşünsünlər, nə vaxta kimi biz müsəlmanları belə qəflət yuxusu tutub, ayılmayacağıq? Sanki "Allah onların qəlblərini möhürləmişdir" ayəsi biz müsəlmanların haqqında imiş. Allah peyğəmbər və övliyalarına tabe olanları müvəffəq edəndir).*

**25) (اِنَّ الَّذِينَ ارْتَدُّوا عَلٰى اَدْبَارِهِمْ مِنْ بَعْدِ مَا تَبَيَّنَ لَهُمُ الْهُدَى الشَّيْطَانُ سَوَّلَ لَهُمْ وَاَمْلٰى لَهُمْ)** - (Ey Məhəmməd), **həqiqətən, o şəxslər ki,** (münafiqlər) **onlardan ötrü hidayət dəlilləri və sənin haqq olmağın zahir və aşkar olandan sonra mürtəd olub, islamdan çıxdılar, şeytan böyük günahlar etməyi onlar üçün asan edib, zinət verdi, buna çatmaq üçün onlara ömürlərini uzun göstərdi ki, məğrur olub, aldanıb, Allah-Təalaya kafir olsunlar.**

**26) (ذٰلِكَ بِاَنَّهُمْ قَالُوا لِلَّذِينَ كَرِهُوا مَا نَزَّلَ اللّٰهُ سَنُطِيعُكُمْ فِي بَعْضِ الْاَمْرِ) - Şeytanın münafiqlər üçün böyük günahları asan etməsi bu səbəbdəndir: "Münafiqlər Allah-Təalanın nazil etdiyi Quranı bəyənməyən yəhudilərə dedilər: "Bəzi işlərdə** (Məhəmmədə düşmən olub, kömək etməməkdə) **sizə itaət edərik".**

**(وَاللّٰهُ يَعْلَمُ اِسْرَارَهُمْ) Allah-Təala münafiqlərin hər bir sirrinə agahdır. Heç bir şey ona məxfi qalmaz.**

**27) (فَكَيْفَ اِذَا تَوَفَّتْهُمُ الْمَلٰئِكَةُ يَضْرِبُونَ وُجُوهَهُمْ وَاَدْبَارَهُمْ)** - (Ey Məhəmməd), **məlaikə onları öldürüb, üzlərinə və dillərinə əzab qamçısı ilə vurub, onlara əzab edərkən, münafiqlərin halı necə olar?**

**28) (ذٰلِكَ بِاَنَّهُمُ اتَّبَعُوا مَٓا اَسْخَطَ اللّٰهَ وَكَرِهُوا رِضْوَانَهُ فَاَحْبَطَ اَعْمَالَهُمْ) - Məlaikənin münafiqlərə əzab etməsi o səbəbdəndir ki, onlar Allah-Təalanı qəzəbləndirən işə** (Allahın peyğəmbərinə düşmən olmağa) **tabe olub, Allah-Təalanın məmnunluğunu** (peyğəmbərə iman etməyi) **rədd etdilər. Allah-Təala da onların əməllərini batil edib, heç bir xeyir əməlləri onlara fayda verməyəcəkdir.**

**29) (اَمْ حَسِبَ الَّذِينَ فِي قُلُوبِهِمْ مَرَضٌ اَنْ لَنْ يُخْرِجَ اللّٰهُ اَضْغَانَهُمْ) - Bəs qəlblərində nifaq xəstəliyi olanlar elə güman edirlər ki, onların Allahın Rəsuluna olan kin və ədavətlərini Allah-Təala izhar etməyəcəkdir?**

وَلَوْ نَشَآءُ لَاَرَيْنَاكَهُمْ فَلَعَرَفْتَهُمْ بِسِيمٰيهُمْ ۜ وَلَتَعْرِفَنَّهُمْ فِي لَحْنِ الْقَوْلِۜ وَاللّٰهُ يَعْلَمُ اَعْمَالَكُمْ ﴿٣٠﴾
وَلَنَبْلُوَنَّكُمْ حَتّٰى نَعْلَمَ الْمُجَاهِدِينَ مِنْكُمْ وَالصَّابِرِينَ ۙ وَنَبْلُوَا اَخْبَارَكُمْ ﴿٣١﴾ اِنَّ الَّذِينَ كَفَرُوا
وَصَدُّوا عَنْ سَبِيلِ اللّٰهِ وَشَآقُّوا الرَّسُولَ مِنْ بَعْدِ مَا تَبَيَّنَ لَهُمُ الْهُدٰى ۙ لَنْ يَضُرُّوا اللّٰهَ شَيْـًٔا ۜ وَسَيُحْبِطُ
اَعْمَالَهُمْ ﴿٣٢﴾ يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا اَطِيعُوا اللّٰهَ وَاَطِيعُوا الرَّسُولَ وَلَا تُبْطِلُوٓا اَعْمَالَكُمْ ﴿٣٣﴾ اِنَّ
الَّذِينَ كَفَرُوا وَصَدُّوا عَنْ سَبِيلِ اللّٰهِ ثُمَّ مَاتُوا وَهُمْ كُفَّارٌ فَلَنْ يَغْفِرَ اللّٰهُ لَهُمْ ﴿٣٤﴾ فَلَا تَهِنُوا وَتَدْعُوٓا
اِلَى السَّلْمِۗ وَاَنْتُمُ الْاَعْلَوْنَۗ وَاللّٰهُ مَعَكُمْ وَلَنْ يَتِرَكُمْ اَعْمَالَكُمْ﴿٣٥﴾

---

**30-31) (**وَلَوْ نَشَآءُ لَاَرَيْنَاكَهُمْ فَلَعَرَفْتَهُمْ بِسِيمٰيهُمْ ۜ وَلَتَعْرِفَنَّهُمْ فِي لَحْنِ الْقَوْلِۜ**)** - (Ey Məhəmməd), **əgər istəsək münafiqləri sənə göstərib tanıdarıq, o vaxt da onları nifaq əlamətilə tanıyarsan, lakin bizim tanıtdırmağımıza ehtiyac olmayıb, əlbəttə onların danışmaqlarından onlara arif olarsan.**

**(**وَاللّٰهُ يَعْلَمُ اَعْمَالَكُمْ**) - Ey münafiqlər, Allah-Təala sizin bütün əməllərinizə agahdır və heç bir şey ona məxfi deyildir.**

**(**وَلَنَبْلُوَنَّكُمْ حَتّٰى نَعْلَمَ الْمُجَاهِدِينَ مِنْكُمْ وَالصَّابِرِينَ ۙ وَنَبْلُوَا اَخْبَارَكُمْ**) - İmtahan edənlər kimi sizləri imtahan edirik ki, sizlərdən cihad edib səbir edənləri digərlərindən seçib və sizin gizlin xəbərlərinizi zahir və aşkar edək.**

**32) (**اِنَّ الَّذِينَ كَفَرُوا وَصَدُّوا عَنْ سَبِيلِ اللّٰهِ وَشَآقُّوا الرَّسُولَ مِنْ بَعْدِ مَا تَبَيَّنَ لَهُمُ الْهُدٰى ۙ لَنْ يَضُرُّوا اللّٰهَ شَيْـًٔا ۜ وَسَيُحْبِطُ اَعْمَالَهُمْ**) - Həqiqətən, o şəxslər ki onlardan ötrü hidayətin dəlil və sübutları zahir və aşkar olandan sonra kafir olub, başqa şəxslərə də Allah-Təalanın dininə daxil olmağa mane olub, peyğəmbərimiz Məhəmmədə müxalifət edirlər, onlar heç bir zaman Allah-Təalaya heç bir zərər yetirə bilməyib, ümidvar olduqları xeyir əməlləri batil olub, onlara bir fayda verməyəcəkdir.**

**33) (**يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا اَطِيعُوا اللّٰهَ وَاَطِيعُوا الرَّسُولَ وَلَا تُبْطِلُوٓا اَعْمَالَكُمْ**) - Ey iman edənlər, Allah-Təala və onun peyğəmbəri** (Məhəmmədə) **itaət edib,** (böyük günahlar etməklə) **itaət və ibadətinizi batil etməyin.**

**34) (**اِنَّ الَّذِينَ كَفَرُوا وَصَدُّوا عَنْ سَبِيلِ اللّٰهِ ثُمَّ مَاتُوا وَهُمْ كُفَّارٌ فَلَنْ يَغْفِرَ اللّٰهُ لَهُمْ**) - Həqiqətən, o şəxslər ki, kafir olub, xalqı Allah-Təalanın dininə** (islama) **daxil olmaqdan mane olub, ondan sonra küfr halətində ölüm onları dərk etsə, Allah-Təala onları bağışlamaz.**

**35) (**فَلَا تَهِنُوا وَتَدْعُوٓا اِلَى السَّلْمِۗ وَاَنْتُمُ الْاَعْلَوْنَۗ وَاللّٰهُ مَعَكُمْ وَلَنْ يَتِرَكُمْ اَعْمَالَكُمْ**) - Ey möminlər düşməndən ötrü zəlil olub özünüzü onlara zəif göstərməyin. Onlar sizinlə müharibə həddinə gələndə onları sülhə dəvət etməyin. Siz onlara üstün və qalib olacaqsınız. Belə olduğu halda onlara sülh təklifi gərək deyil. Allah Təala sizə köməkdir. Sizin əməllərinizi itirməz və əksiltməz. Sizi düşmənə qalib edib İslam dinini ucaldacaqdır.**

إِنَّمَا الْحَيٰوةُ الدُّنْيَا لَعِبٌ وَلَهْوٌ ۜ وَاِنْ تُؤْمِنُوا وَتَتَّقُوا يُؤْتِكُمْ اُجُورَكُمْ وَلَا يَسْـَٔلْكُمْ اَمْوَالَكُمْ ﴿٣٦﴾ اِنْ
يَسْـَٔلْكُمُوهَا فَيُحْفِكُمْ تَبْخَلُوا وَيُخْرِجْ اَضْغَانَكُمْ ﴿٣٧﴾ هَٓا اَنْتُمْ هٰٓؤُلَٓاءِ تُدْعَوْنَ لِتُنْفِقُوا فِي سَبِيلِ اللّٰهِۚ
فَمِنْكُمْ مَنْ يَبْخَلُۚ وَمَنْ يَبْخَلْ فَاِنَّمَا يَبْخَلُ عَنْ نَفْسِهِۜ وَاللّٰهُ الْغَنِيُّ وَاَنْتُمُ الْفُقَرَٓاءُۚ وَاِنْ تَتَوَلَّوْا يَسْتَبْدِلْ
قَوْمًا غَيْرَكُمْۙ ثُمَّ لَا يَكُونُوٓا اَمْثَالَكُمْ ﴿٣٨﴾

**36) (إِنَّمَا الْحَيٰوةُ الدُّنْيَا لَعِبٌ وَلَهْوٌ ۜ وَاِنْ تُؤْمِنُوا وَتَتَّقُوا يُؤْتِكُمْ اُجُورَكُمْ) -Siz ki, dünya ilə məşğul olub axirəti unudursunuz, həqiqətən, dünya həyatı uşaq oyunu kimi bir şeydir. Tezliklə fani olacaq. Əgər siz axirətə iman edib təqva etsəniz, Allah-Təala iman və təqva savabını sizə bəxş edər. (وَلَا يَسْـَٔلْكُمْ اَمْوَالَكُمْ) - Bizim peyğəmbərimiz** (Məhəmməd) **sizdən mallarınızı soruşub demir ki, malınızı gərək mənə verəsiniz. Əgər sizdən mal istəsə, zəkat istəyəcəkdir. O da sizin faydanız üçün sərf olunmaqdan ötrüdür.**

**(اِنْ يَسْـَٔلْكُمُوهَا فَيُحْفِكُمْ تَبْخَلُوا وَيُخْرِجْ اَضْغَانَكُمْ) - Əgər sizin malınızdan zəkat istəyib, bunu israrla tələb etsə, o vaxt siz zəkat verməkdə xəsislik edib verməyəcəksiniz. Allah-Təala da sizin peyğəmbərə olan kin, ədavətinizi ortaya çıxaracaqdır.**

**37) (هَٓا اَنْتُمْ هٰٓؤُلَٓاءِ تُدْعَوْنَ لِتُنْفِقُوا فِي سَبِيلِ اللّٰهِ) - Siz bilin və xəbərdar olun ki, bu** (Məhəmməd) **sizi malınızı Allah-Təalanın yolunda, din və ümmətin xeyri üçün sərf etməyə dəvət edir, (فَمِنْكُمْ مَنْ يَبْخَلُۚ وَمَنْ يَبْخَلْ) - amma sizlərdən bəzi şəxslər vardır ki, xəsislik edib malını xərcləmir.**

**(فَاِنَّمَا يَبْخَلُ عَنْ نَفْسِهِۜ) - Kim ki, xəsislik edib malını xərcləməsə, həqiqətən, o şəxs özü xəsislik edib, onu buna vadar edən yoxdur və bu səbəbdən o xəsisliyin zərəri öz nəfsinə aid olar. (وَاللّٰهُ الْغَنِيُّ وَاَنْتُمُ الْفُقَرَٓاءُ) - Allah-Təala sizin malınızdan və xərcləməyinizdən ehtiyacsız olub varlıdır. Siz Allah-Təalaya möhtacsınız. Xərcləməyinizin Allah-Təalaya bir faydası yoxdur. Onun faydası özünüzə aiddir. (وَاِنْ تَتَوَلَّوْا) - Siz əgər Allah-Təalaya və onun peyğəmbəri** (Məhəmmədə) **iman etməkdən üz döndərsəniz, (يَسْتَبْدِلْ قَوْمًا غَيْرَكُمْ) - sizdən başqa bir qövm və camaatı sizin əvəzinizə gətirər, onlar sizdən sonra gəlib Allah-Təalaya və peyğəmbərə itaət edərlər. (ثُمَّ لَا يَكُونُوٓا اَمْثَالَكُمْ) - İtaət edəndən sonra daha sizin kimi olmazlar, bəlkə itaətlərində sabit və möhkəm olub heç bir vaxt itaətdən çıxmazlar.** (Bu ayədə bəhs olunan şəxslərdən məqsəd Allahın Rəsulundan sonra səhabələr zamanında dünyaya gəlib, islam yolunda cihad edib, fəthləri ilə islam ərazilərini genişlədən şücaətli insanlardır. Allah onlardan razı olsun).

**Allaha həmd olsun, Məhəmməd surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurubdur: "Kim Məhəmməd surəsini oxusa, Allah-Təala onu cənnət çaylarından içizdirər.**

## əl-FƏTH SURƏSİ

48-ci surədir. Mədinədə nazil olub, 29 ayə, 560 kəlmə və 4803 hərfdir.

إِنَّا فَتَحْنَا لَكَ فَتْحًا مُبِينًاۙ ﴿١﴾ لِيَغْفِرَ لَكَ اللّٰهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِكَ وَمَا تَاَخَّرَ وَيُتِمَّ نِعْمَتَهُ عَلَيْكَ وَيَهْدِيَكَ
صِرَاطًا مُسْتَقِيمًاۙ ﴿٢﴾ وَيَنْصُرَكَ اللّٰهُ نَصْرًا عَزِيزًا ﴿٣﴾ هُوَ الَّذِيٓ اَنْزَلَ السَّكِينَةَ فِي قُلُوبِ الْمُؤْمِنِينَ
لِيَزْدَادُوٓا إِيمَانًا مَعَ إِيمَانِهِمْۜ وَلِلّٰهِ جُنُودُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ وَكَانَ اللّٰهُ عَلِيمًا حَكِيمًاۙ ﴿٤﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1-2) (إِنَّا فَتَحْنَا لَكَ فَتْحًا مُبِينًاۙ)** - (Ey Məhəmməd**), həqiqətən, biz sənə açıq-aşkar fəth bəxş edib, sən zəif olduğun halda səni müşriklərə qalib edib, islamı ucaldıb, şirk və küfrü məhv etdik. Bundan böyük və üstün fəth olmaz. Müfəssirlərin bəzisi bu fəthi Məkkə, bəzisi Hüdeybiyyə, bəzisi Xeybərin fəthinə, bəziləri də digər fəthlərə aid ediblər. Lakin bu fəthlərin hamısı ayənin mənasında bəhs olunan fəthin ehtivasına daxildir. Xüsusi olaraq, bu fəthlərin birinə məxsus etmək doğru deyildir. Bütün islam fəthlərini ehtiva edir. (لِيَغْفِرَ لَكَ اللّٰهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِكَ وَمَا تَاَخَّرَ)** - (Ey Məhəmməd), **Allah-Təala islamı ucaldıb, tövhidi şirkə qalib etdi və xalqın gözündə günah sayılan sənin kiçik qüsurlarını bağışladı ki, dünya və axirət izzətini sənin üçün cəm etsin. (وَيُتِمَّ نِعْمَتَهُ عَلَيْكَ وَيَهْدِيَكَ صِرَاطًا مُسْتَقِيمًاۙ) - Və bu fəth səbəbi ilə Allah-Təala hər bir neməti sənin üçün tamamlayıb, peyğəmbərlik libasını sənə geyindirdi ki, səni düz yolda, islamda sabit və bərqərar etsin.**

**3) (وَيَنْصُرَكَ اللّٰهُ نَصْرًا عَزِيزًا) - Allah-Təala islam düşmənlərinə qarşı qələbə yardımını sənə verib, səni düşməninə qalib etsin.** (Bu səbəblərdən ötrü Allah-Təala sənə kömək olub islamı yaydı).

**4) (هُوَ الَّذِيٓ اَنْزَلَ السَّكِينَةَ فِي قُلُوبِ الْمُؤْمِنِينَ لِيَزْدَادُوٓا إِيمَانًا مَعَ إِيمَانِهِمْ)** - (Ey Məhəmməd), **Allah-Təala öz kamil qüdrəti ilə möminlərin qəlblərinə sənə nazil olan ehkam barəsində təmkinlilik, arxayınlıq göndərdi ki, tövhidə iman gətirməklə birlikdə sənə nazil olan ehkam və şəriətə olan imanlarını da artırıb, imanlarında sabit və bərqərar olsunlar.**

**(وَلِلّٰهِ جُنُودُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ وَكَانَ اللّٰهُ عَلِيمًا حَكِيمًاۙ) - Göylərin və yerin qoşunlarına malik olmaq Allah-Təalaya məxsusdur. Bəzilərini bəzilərinə hakim edib fəsadçıların fəsadını, şərirlərin şərini dəf edir.** (Necə ki siz müsəlmanları müşriklərə hakim edib, onların fəsadını dəf etdi). **Allah-Təala hər bir şeydən agah və onların işlərində hikmət sahibidir.**

لِيُدْخِلَ الْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَا وَيُكَفِّرَ عَنْهُمْ سَيِّاٰتِهِمْ
وَكَانَ ذٰلِكَ عِنْدَ اللّٰهِ فَوْزًا عَظِيمًاۙ ﴿٥﴾ وَيُعَذِّبَ الْمُنَافِقِينَ وَالْمُنَافِقَاتِ وَالْمُشْرِكِينَ وَالْمُشْرِكَاتِ
الظَّٓانِّينَ بِاللّٰهِ ظَنَّ السَّوْءِۜ عَلَيْهِمْ دَٓائِرَةُ السَّوْءِۚ وَغَضِبَ اللّٰهُ عَلَيْهِمْ وَلَعَنَهُمْ وَاَعَدَّ لَهُمْ جَهَنَّمَۜ وَسَٓاءَتْ
مَصِيرًا ﴿٦﴾ وَلِلّٰهِ جُنُودُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ وَكَانَ اللّٰهُ عَزِيزًا حَكِيمًا ﴿٧﴾ اِنَّٓا اَرْسَلْنَاكَ شَاهِدًا
وَمُبَشِّرًا وَنَذِيرًاۙ ﴿٨﴾ لِتُؤْمِنُوا بِاللّٰهِ وَرَسُولِهِ وَتُعَزِّرُوهُ وَتُوَقِّرُوهُۜ وَتُسَبِّحُوهُ بُكْرَةً وَاَصِيلًا ﴿٩﴾

---

**5) (لِيُدْخِلَ الْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَا وَيُكَفِّرَ عَنْهُمْ سَيِّاٰتِهِمْ) Allah-Təala şəriət ehkamı barəsində möminlərin qəlblərinə təmkin və vüqar göndərdi ki, mömin kişi və qadınlara mükafat verib onları elə cənnət bağlarına daxil etsin ki, o bağların ağaclarının və qəsrlərinin altından çaylar axır və tövbə olunmayan kiçik günahlarını onlara bağışlasın.**

**(وَكَانَ ذٰلِكَ عِنْدَ اللّٰهِ فَوْزًا عَظِيمًاۙ) - Bu günahların bağışlanması və cənnətlərə daxil olmaq Allah-Təalanın yanında böyük savaba qovuşmaqdır.**

**6) (وَيُعَذِّبَ الْمُنَافِقِينَ وَالْمُنَافِقَاتِ وَالْمُشْرِكِينَ وَالْمُشْرِكَاتِ) - Və yenə Allah-Təala möminlərə təmkin və vüqar göndərdi ki, nifaq və şirkdə sabit və bərqərar olan kişilərə və qadınlara əzab etsin. (الظَّٓانِّينَ بِاللّٰهِ ظَنَّ السَّوْءِۜ) - Hansı ki, o münafiq və müşriklər Allah-Təalaya bədgüman olub deyirdilər: "Allah-Təala peyğəmbərə və möminlərə kömək olmayıb, islam dini batil və fani olacaqdır. (عَلَيْهِمْ دَٓائِرَةُ السَّوْءِۚ وَغَضِبَ اللّٰهُ عَلَيْهِمْ وَلَعَنَهُمْ وَاَعَدَّ لَهُمْ جَهَنَّمَۜ وَسَٓاءَتْ مَصِيرًا) - Münafiq və müşriklərin etdikləri bədgüman özlərinə vaqe olub həlak olsunlar, Allah-Təala onlara qəzəb və lənət edib, cəhənnəmi onlardan ötrü hazırlayıb, onlardan ötrü nə pis dönüləcək yerdir cəhənnəm, öləndən sonra cəhənnəmə daxil olacaqlar.**

**7) (وَلِلّٰهِ جُنُودُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ وَكَانَ اللّٰهُ عَزِيزًا حَكِيمًا) - Göylərin və yerlərin qoşunlarına malik olmaq Allah-Təalaya məxsusdur. Allah-Təala məxluqata qalib və hər bir işlərində hikmət sahibidir.**

**8-9) (اِنَّٓا اَرْسَلْنَاكَ شَاهِدًا وَمُبَشِّرًا وَنَذِيرًاۙ)** - (Ey Məhəmməd), **həqiqətən, biz səni ümmətin əməllərinə şahid və bizim rəhmətimizlə müjdələyən və əzabımızla qorxudan olaraq göndərmişik. Gərək bu işlərdə möhkəm olasan.**

**(لِتُؤْمِنُوا بِاللّٰهِ وَرَسُولِهِ وَتُعَزِّرُوهُ وَتُوَقِّرُوهُۜ وَتُسَبِّحُوهُ بُكْرَةً وَاَصِيلًا) - Allah-Təala siz möminlərə peyğəmbəri** (Məhəmmədi) **göndərdi ki, Allah-Təalaya və onun peyğəmbərinə iman edib, Allah-Təalanın dininə kömək edib, Allah-Təalaya təzim və təvazökarlıq edib, səhər-axşam, gərək, onu təsbih edib** (uca sayıb), **hər bir eyib və nöqsandan onu pak və müqəddəs sayasınız. Uca peyğəmbər digərnəfərlə Məkkədə Kəbəni təvaf üçün Mədinədən çıxıb Şəcərə məscidində** (Zül-hüfeyldə) **ehrama girdilər. Neçə gün yol gedib**

**Məkkəyə yaxın olan Hüdeybiyyə adlı yerə çatdılar. Orada Allahın Rəsulu eşitdi ki, Məkkə əhli onu Məkkəyə daxil olmaqdan mane olacaqdır. Xüzaə qəbiləsindən Cəvvas** (Hiraş) **ibn Ümeyyə adlı şəxsi özünün Sələb adlı dəvəsinə mindirib Məkkəyə göndərdi ki, məqsədini onlara bildirsin. Cəvvas Məkkəyə gedib peyğəmbərin məqsədini onlara bildirəndən sonra peyğəmbərin dəvəsinin ayağındakı damarı kəsib öldürüb, Cəvvasın özünü də qətl etmək istədilər. Məkkə ətrafında yaşayan Əhabiş camaatı onun qətl edilməsinə mane oldular. Cəvvas qayıdıb hadisəni Allahın peyğəmbərinə nəql etdi. O cənab Ömər ibn Xəttabı çağırıb istədi Məkkəyə göndərsin. Ömər dedi ki, ey peyğəmbər, mən qorxuram ki, Qüreyş camaatı məni qətl etsin, Qüreyş mənim onlara olan ədavətimə agahdır. Bəni-Ədiy camaatından** (Ömərin qəbiləsi) **Məkkədə bir nəfər yoxdur ki, mənə kömək olsun. Lakin mən sənə Qüreyş camaatının yanında məndən əziz və möhtərəm olan şəxsi göstərərəm. Budur, Osman ibn Əffan, onu göndər. Peyğəmbər Osmanı Məkkəyə göndərdi. Osman gedib Məkkəyə varid oldu. Məkkə əhlinə dedi: "Allahın Rəsulu Kəbəyə ziyarətə gəlibdir, mane olmayın. Qüreyş camaatı dedilər: "Məhəmmədə Məkkəyə daxil olmağa izin yoxdur. Lakin əgər sən Kəbəni tavaf etmək istəyirsənsə, et.**

**Osman dedi: "Peyğəmbər tavaf etməmiş, mən təvaf etmərəm. Qüreyş camaatı Osmanın peyğəmbərin yanına getməsinə mane olub saxladılar. Peyğəmbərə xəbər verdilər ki, Qüreyşlilər Osmanı qətl etdi. Allahın Rəsulu buyurdu: "Daha buradan getmək olmaz. Gərək Qüreyş camaatı ilə savaşaq. Orada olan camaatı savaşdan ötrü beyətə çağırdı. Özü bir ağaca söykənib, onun kölgəsində oturduğu halda camaat ona beyət etdi. O beyətin adına bundan sonra növbəti ayəyə görə "beyət-ür-rizvan" deyilir. Abdullah ibn Məğfəl deyir: "Mən peyğəmbərin başının üstündə dayanmışdım. Ağacın bir budağı peyğəmbərin çiyninə düşmüşdü. O budağı peyğəmbərin çiynindən götürdüm. Orada olanların hamısı qaçmayıb ölmək şərtilə o cənaba beyət etdilər. Ancaq bir nəfər Cədd ibn Qeys beyət etmədi, Cabir ibn Abdullah Ənsari deyir: "Mən baxıb gördüm ki, Cədd ibn Qeys özünü dəvənin qoltuğuna sıxıb xalqdan gizlənirdi. Ondan sonra Qüreyşdən bir neçə nəfər gəlib peyğəmbərlə sülh bağladılar ki, o il qayıdıb getsin. Gələn il gəlib Kəbəni ziyarət etsin. Allahın Rəsulu ehramdan çıxıb, başını qırxıb, qurbanlarını kəsib, oradan Mədinəyə qayıtdı. Bundan sonra Hüdeybiyyə əhvalatından təfsilatlı şəkildə bəhs olunacaq. Bundan sonra bəhs olunan ayələrdə bu beyətə - "beyət-ür-rizvan"a işarə olunur).**

**10) (اِنَّ الَّذٖينَ يُبَايِعُونَكَ اِنَّمَا يُبَايِعُونَ اللّٰهَ)** - (Ey Məhəmməd), **o şəxslər ki, sənə**

يَدُ اللّٰهِ فَوْقَ اَيْد۪يهِمْۚ فَمَنْ نَكَثَ فَاِنَّمَا يَنْكُثُ عَلٰى نَفْسِه۪ۚ وَمَنْ اَوْفٰى بِمَا عَاهَدَ عَلَيْهُ اللّٰهَ فَسَيُؤْت۪يهِ اَجْرًا
عَظ۪يمًا ﴿١٠﴾ سَيَقُولُ لَكَ الْمُخَلَّفُونَ مِنَ الْاَعْرَابِ شَغَلَتْنَٓا اَمْوَالُنَا وَاَهْلُونَا فَاسْتَغْفِرْ لَنَاۚ يَقُولُونَ
بِاَلْسِنَتِهِمْ مَا لَيْسَ ف۪ي قُلُوبِهِمْۜ قُلْ فَمَنْ يَمْلِكُ لَكُمْ مِنَ اللّٰهِ شَيْـًٔا اِنْ اَرَادَ بِكُمْ ضَرًّا اَوْ اَرَادَ بِكُمْ نَفْعًاۜ
بَلْ كَانَ اللّٰهُ بِمَا تَعْمَلُونَ خَب۪يرًا ﴿١١﴾ بَلْ ظَنَنْتُمْ اَنْ لَنْ يَنْقَلِبَ الرَّسُولُ وَالْمُؤْمِنُونَ اِلٰٓى اَهْل۪يهِمْ اَبَدًا

---

**beyət edirlər, həqiqətən onlar Allah-Təalaya beyət edirlər, sənə beyət etmək həqiqətən mənə beyət etməkdir. (**يَدُ اللّٰهِ فَوْقَ اَيْد۪يهِمْ**)** - (Ey Məhəmməd), **sənin əlin beyət edənlərin əlinin üstündə olub, Allah-Təalanın əli kimidir.** (Hərçənd Allah-Təala cismdən uzaqdır). **(**فَمَنْ نَكَثَ فَاِنَّمَا يَنْكُثُ عَلٰى نَفْسِه۪**)** - (Ey Məhəmməd), **kim ki, əhd və beyət edəndən sonra o əhd və beyəti pozsa, həqiqətən, o şəxs o əhd və beyəti öz nəfsinin zərərinə pozub, zərəri onun öz nəfsinə aid olar. (**وَمَنْ اَوْفٰى بِمَا عَاهَدَ عَلَيْهُ اللّٰهَ فَسَيُؤْت۪يهِ اَجْرًا عَظ۪يمًا**) - Və kim ki, Allahın onunla etdiyi əhdə** (Hüdeybiyyədə etdiyi beyətə) **vəfa etsə, əlbəttə ona böyük əcr və savab bəxş edərik. Allahın Rəsulu (ə.s) Hüdeybiyyə ilində Məkkəyə gedən vaxt Qüreyşin ona mane olmasından, ya da ki, onunla savaşmasından qorxub, Mədinə ətrafında olan ərəbləri köməyə çağırdı. Onlardan** (Ğifar, Müzeynə, Cüheynə, Əşca, Əsləm, Əd-Deyl) **qəbilələri peyğəmbərdən üz döndərib, onunla birlikdə Məkkəyə gəlmədilər. Peyğəmbər qayıdıb Mədinəyə gələndən sonra onlar gəlib üzr istədilər, bundan sonrakı ayələr onların barəsində nazil oldu.**

**11) (**سَيَقُولُ لَكَ الْمُخَلَّفُونَ مِنَ الْاَعْرَابِ شَغَلَتْنَٓا اَمْوَالُنَا وَاَهْلُونَا فَاسْتَغْفِرْ لَنَاۚ**)** - (Ey Məhəmməd), **Hüdeybiyyədən geri qalan bədəvi ərəblər sənin yanına gəlib üzr istəyib belə deyirlər: "Ey peyğəmbər, malımız və ailəmiz bizi məşğul edib, səninlə birlikdə Məkkəyə gəlməkdən bizə mane oldu. Xahiş edirik ki, bizdən ötrü Allah-Təaladan əfv istə, bizi bağışlasın. (**يَقُولُونَ بِاَلْسِنَتِهِمْ مَا لَيْسَ ف۪ي قُلُوبِهِمْ**)** - (Ey Məhəmməd), **bu bədəvilər üzr istəyib o sözləri deyirlər ki, qəlbləri o sözlərdən boşdur. Üzr istəyib deyirlər ki, ailəmiz bizi məşğul etdi, yalan deyirlər, əksinə onları məşğul edən şey dinə şəkk etmələri və nifaqlarıdır. (**قُلْ فَمَنْ يَمْلِكُ لَكُمْ مِنَ اللّٰهِ شَيْـًٔا اِنْ اَرَادَ بِكُمْ ضَرًّا اَوْ اَرَادَ بِكُمْ نَفْعًاۜ**)** - (Ey Məhəmməd), **onlara de ki, əgər Allah-Təala sizə bir zərər vermək istəsə,** (düşməni sizə qalib etsə), **ya da ki, sizə bir xeyir və mənfəət vermək istəsə, (sizi düşmənə qalib etsə), o vaxt kim hər bir şeyə malik olan Allah-Təalanın sizə olan xeyir və zərərinə mane ola bilər? (**بَلْ كَانَ اللّٰهُ بِمَا تَعْمَلُونَ خَب۪يرًا**) - Əksinə, Allah-Təala sizin əməllərinizə** (zahirdə üzr istəyib, batindəki küfr və nifaqınıza) **agah və xəbərdardır.**

**12) (**بَلْ ظَنَنْتُمْ اَنْ لَنْ يَنْقَلِبَ الرَّسُولُ وَالْمُؤْمِنُونَ اِلٰٓى اَهْل۪يهِمْ اَبَدًا**) - Allahın Rəsulu ilə Məkkəyə getmədiyiniz üçün etdiyiniz üzr yalandır. Bəlkə siz elə güman**

وَزُيِّنَ ذٰلِكَ فِي قُلُوبِكُمْ وَظَنَنْتُمْ ظَنَّ السَّوْءِ وَكُنْتُمْ قَوْمًا بُورًا ﴿١٢﴾ وَمَنْ لَمْ يُؤْمِنْ بِاللّٰهِ وَرَسُولِهِ فَاِنَّآ اَعْتَدْنَا لِلْكَافِرِينَ سَعِيرًا ﴿١٣﴾ وَلِلّٰهِ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِ يَغْفِرُ لِمَنْ يَشَآءُ وَيُعَذِّبُ مَنْ يَشَآءُ وَكَانَ اللّٰهُ غَفُورًا رَحِيمًا ﴿١٤﴾ سَيَقُولُ الْمُخَلَّفُونَ اِذَا انْطَلَقْتُمْ اِلٰى مَغَانِمَ لِتَاْخُذُوهَا ذَرُونَا نَتَّبِعْكُمْ يُرِيدُونَ اَنْ يُبَدِّلُوا كَلَامَ اللّٰهِ قُلْ لَنْ تَتَّبِعُونَا كَذٰلِكُمْ قَالَ اللّٰهُ مِنْ قَبْلُ

---

**etdiniz ki, peyğəmbərimiz** (Məhəmməd) **və möminlər bu səfərə** (Məkkəyə) **gedib daha Mədinəyə, ailələrinin yanına əsla qayıdıb gəlməyəcəklər? Bəlkə də Qüreyş camaatı onları qətl edəcəkdir. Bu səbəbə görə onunla birlikdə getmədiniz. (وَزُيِّنَ ذٰلِكَ فِي قُلُوبِكُمْ وَظَنَنْتُمْ ظَنَّ السَّوْءِ وَكُنْتُمْ قَوْمًا بُورًا)- Həmin bu güman etdiyinizi** (peyğəmbərin və möminlərin öldürülməsini) **şeytan** (şəri əmr edən xəbis nəfs) **sizin qəlbinizə gözəl göstərdi. Lakin bədgüman və fəsadçı niyyətiniz səbəbi ilə məhv olan camaat oldunuz.**

**13) (وَمَنْ لَمْ يُؤْمِنْ بِاللّٰهِ وَرَسُولِهِ فَاِنَّآ اَعْتَدْنَا لِلْكَافِرِينَ سَعِيرًا) - Və kim ki, Allah-Təalaya və onun peyğəmbərinə iman etməyib, Allah-Təalanın vədini təkzib etsə, həqiqətən, biz elə kafirlərdən ötrü alovlanan xüsusi od hazırlamışıq.**

**14) (وَلِلّٰهِ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِ يَغْفِرُ لِمَنْ يَشَآءُ وَيُعَذِّبُ مَنْ يَشَآءُ وَكَانَ اللّٰهُ غَفُورًا رَحِيمًا) - Göylərin və yerin səltənəti Allah-Təalaya məxsusdur. Kimi istəsə** (tövbə edənləri) **bağışlayar və kimə istəsə** (tövbə etməyənlərə) **əzab edər. Allah-Təala tövbə edənlərə rəhm edib onları bağışlayandır.** (Allahın Rəsulu (ə.s) Hüdeybiyyədə Xeybərin fəthini səhabələrinə vəd etdi. Elə ki, Mədinəyə varid olub Xeybərə yönəldilər, o vaxt Hüdeybiyyədən geri qalanlar Xeybərdə qənimət olacağını düşünüb, peyğəmbərdən Xeybərə getmək üçün izin istədilər. O barədə növbəti ayə nazil oldu).

**15) (سَيَقُولُ الْمُخَلَّفُونَ اِذَا انْطَلَقْتُمْ اِلٰى مَغَانِمَ لِتَاْخُذُوهَا ذَرُونَا نَتَّبِعْكُمْ) - O zaman ki, qənimətlərin tərəfinə** (Xeybər qənimətinə) **yönəldiniz ki, o qənimətləri əldə edəsiniz, o vaxt** (Hüdeybiyyədən) **geri qalanlar sizə deyərlər: "Bizə də izin verin, sizə tabe olub Xeybərə gedək. (يُرِيدُونَ اَنْ يُبَدِّلُوا كَلَامَ اللّٰهِ) - Onların Xeybər savaşına getməkdə istəkləri odur ki, Allah-Təalanın kəlamını** (vədini) **ki, peyğəmbərinin diliylə möminlərə vəd edibdir,** (Xeybər qəniməti sizə məxsusdur vədi) **dəyişdirsinlər. Allahın Rəsulu buyurdu: "Xeybər qənimətini Allah-Təala Hüdeybiyyədə olanlara məxsus edibdir. Başqa şəxslərin onda bir haqqı yoxdur." Hüdeybiyyədən geri qalanlar Xeybərə getmək üçün səy edirdilər ki, qənimət götürüb peyğəmbərin sözünü təkzib etsinlər. Necə ki, ayədə buyurur: (قُلْ لَنْ تَتَّبِعُونَا) - Onlara de ki,** (ey Məhəmməd), **əbədiyyən bizə tabe olub, bizimlə birlikdə olmasanız, bu barədə sizə izin yoxdur. (كَذٰلِكُمْ قَالَ اللّٰهُ مِنْ قَبْلُ) - Necə ki, sizə demişəm, Allah-Təala bundan qabaq biz Mədinəyə qayıtmamış deyibdir ki, Xeybər qəniməti Hüdeybiyyədə olanlara məxsusdur. Onlardan başqasına ondan**

فَسَيَقُولُونَ بَلْ تَحْسُدُونَنَا بَلْ كَانُوا لَا يَفْقَهُونَ اِلَّا قَلِيلًا ﴿١٥﴾ قُلْ لِلْمُخَلَّفِينَ مِنَ الْاَعْرَابِ سَتُدْعَوْنَ
اِلٰى قَوْمٍ اُو۬لِي بَاْسٍ شَدِيدٍ تُقَاتِلُونَهُمْ اَوْ يُسْلِمُونَ فَاِنْ تُطِيعُوا يُؤْتِكُمُ اللّٰهُ اَجْرًا حَسَنًا وَاِنْ تَتَوَلَّوْا كَمَا
تَوَلَّيْتُمْ مِنْ قَبْلُ يُعَذِّبْكُمْ عَذَابًا اَلِيمًا﴿١٦﴾ لَيْسَ عَلَى الْاَعْمٰى حَرَجٌ وَلَا عَلَى الْاَعْرَجِ حَرَجٌ وَلَا
عَلَى الْمَرِيضِ حَرَجٌ وَمَنْ يُطِعِ اللّٰهَ وَرَسُولَهُ يُدْخِلْهُ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ

---

**bir hissə və pay yoxdur. Elə belədir ki, demişəm, amma siz istəyirsiniz, Allah-Təalanın vədini təkzib edəsiniz. (فَسَيَقُولُونَ بَلْ تَحْسُدُونَنَا) -** (Ey Məhəmməd), **o münafiqlər əlbəttə, deyəcəkdirlər ki, bu sözlər bəhanədir. Əksinə, siz bizim qənimət almamıza həsəd edib, o səbəbdən bizim Xeybərə getməmizə mane olursunuz.**

**(بَلْ كَانُوا لَا يَفْقَهُونَ اِلَّا قَلِيلا) - Əksinə, münafiqlərin idrakı və fərasətləri az olduğundan onların getməsinə mane olmağınızı həsəd etmənizlə yozurlar.**

**16) (قُلْ لِلْمُخَلَّفِينَ مِنَ الْاَعْرَابِ سَتُدْعَوْنَ اِلٰى قَوْمٍ اُو۬لِي بَاْسٍ شَدِيدٍ تُقَاتِلُونَهُمْ اَوْ يُسْلِمُونَ) -** (Ey Məhəmməd), **Hüdeybiyyədən geri qalan bədəvi ərəblərə de ki, bundan sonra** (peyğəmbər dünyadan köçəndən sonra) **sizi bir qüvvətli və şücaətli camaatla savaşa* çağırırlar, siz onlarla ya savaşıb, onları qətl edərsiniz, ya da ki itaət edib, islama daxil olub cizyə** (xərac) **verərlər, əgər cihada getməyə həvəsli isəniz, o zaman getməyinizin faydası daha çoxdur. (فَاِنْ تُطِيعُوا يُؤْتِكُمُ اللّٰهُ اَجْرًا حَسَنًا) - Əgər o vaxt itaət edib cihada getsəniz, Allah-Təala sizə gözəl əcr və savab verər.**

**(*Qeyd:** *Təfsirçilər deyiblər: "Bu ayə Əbu Bəkir və Ömərin xəlifəliyinə dəlildir. Çünki ayədə vaqe olan cihada dəvət etmək işi peyğəmbərin zamanında vaqe olmadı, əvvəlki ayədə -* **(قل لن تتبعونا) -** *yəni əbədiyyən bizə tabe olub cihada çıxmağa sizə izin verərəm - sözünü peyğəmbər onlara necə deyə bilər, onları yenidən necə cihada dəvət edər? Əksinə, onların cihada dəvət olunması ancaq peyğəmbərdən sonra Əbu Bəkir və Ömər zamanında olubdur. Əbu Bəkir mürtəd ərəblərin və yalançı Müseylimənin cihadına, Ömər Bizans və İranın cihadına xalqı dəvət ediblər. Bunlardan başqa dəvət edən olmayıbdır. Təfsirçilərin bir tərəfdən xilafəti şuraya məxsus edib, digər tərəfdən ayəyə əsaslanmaları təəccüblüdür).*

**(وَاِنْ تَتَوَلَّوْا كَمَا تَوَلَّيْتُمْ مِنْ قَبْلُ يُعَذِّبْكُمْ عَذَابًا اَلِيمًا) - Əgər üz döndərib itaət etməsəniz, necə ki bundan əvvəl** (Hüdeybiyyədə) **itaət etmədiniz, o vaxt Allah-Təala əziyyət verən bir əzabla sizə əzab edər.**

**17) (لَيْسَ عَلَى الْاَعْمٰى حَرَجٌ وَلَا عَلَى الْاَعْرَجِ حَرَجٌ وَلَا عَلَى الْمَرِيضِ حَرَجٌ) - Kor, topalşil və xəstə şəxslərə cihadı tərk etməkdə bir günah yoxdur. Çünki onların problemləri vardır, hansı ki, bu səbəbdən cihad etmək mümkün deyildir. (وَمَنْ يُطِعِ اللّٰهَ وَرَسُولَهُ يُدْخِلْهُ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ) - Kim ki, Allah-Təalaya və onun peyğəmbərinə cihad və başqa əmrlərində itaət etsə, Allah-Təala da o şəxsi axirətdə elə cənnət bağlarına daxil edər ki, onların ağaclarının və**

**وَمَنْ يَتَوَلَّ يُعَذِّبْهُ عَذَابًا اَلِيمًا ﴿١٧﴾ لَقَدْ رَضِيَ اللّٰهُ عَنِ الْمُؤْمِنِينَ اِذْ يُبَايِعُونَكَ تَحْتَ الشَّجَرَةِ فَعَلِمَ مَا فِي قُلُوبِهِمْ فَاَنْزَلَ السَّكِينَةَ عَلَيْهِمْ وَاَثَابَهُمْ فَتْحًا قَرِيبًا ﴿١٨﴾ وَمَغَانِمَ كَثِيرَةً يَاْخُذُونَهَا وَكَانَ اللّٰهُ عَزِيزًا حَكِيمًا ﴿١٩﴾ وَعَدَكُمُ اللّٰهُ مَغَانِمَ كَثِيرَةً تَاْخُذُونَهَا فَعَجَّلَ لَكُمْ هٰذِهٖ وَكَفَّ اَيْدِيَ النَّاسِ عَنْكُمْ وَلِتَكُونَ اٰيَةً لِلْمُؤْمِنِينَ وَيَهْدِيَكُمْ صِرَاطًا مُسْتَقِيمًا ﴿٢٠﴾**

---

**qəsrlərinin altından çaylar axar. (وَمَنْ يَتَوَلَّ يُعَذِّبْهُ عَذَابًا اَلِيمًا) - Və kim ki, Allah-Təalanın və peyğəmbərin əmrlərinə itaət etməyib, üz döndərsə, Allah-Təala da ona əziyyət verən əzab edər.**

**18) (لَقَدْ رَضِيَ اللّٰهُ عَنِ الْمُؤْمِنِينَ اِذْ يُبَايِعُونَكَ تَحْتَ الشَّجَرَةِ) -** (Ey Məhəmməd), **həqiqətən, o zamanda ki,** (Hüdeybiyyədə) **möminlər ağacın altında sənə beyət etdilər, Allah-Təala onlardan razı oldu.** (Bu ayəyə görə bu beyətin adına “Beyət-ür-rizvan” deyilir, necə ki, əvvəl bəhs olundu).

**(فعَلِمَ مَا فِي قُلُوبِهِمْ فَاَنْزَلَ السَّكِينَةَ عَلَيْهِمْ وَاَثَابَهُمْ فَتْحًا قَرِيبًا) - Allah-Təala beyət edən möminlərin qəlblərində olan sədaqət və ixlasa agah olub,** (Hüdeybiyyədə sülh etmək səbəbinə) **onlara təmkin və arxayınlıq göndərib,** (Məkkədən) **qayıdan vaxt da gecikmədən onlara** (Xeybər fəthini) **mükafat verdi.**

**19) (وَمَغَانِمَ كَثِيرَةً يَاْخُذُونَهَا وَكَانَ اللّٰهُ عَزِيزًا حَكِيمًا) - və Allah-Təala möminlərə Xeybərdə çox qənimətlər verdi, o qənimətləri asan yolla əldə etdilər, Allah-Təala məxluqatına qalibdir. Hikmət üzrə sizə qənimət verir.**

**20) (وَعَدَكُمُ اللّٰهُ مَغَانِمَ كَثِيرَةً تَاْخُذُونَهَا) - Allah-Təala siz möminlərə bundan belə çox qənimətlər vəd edibdir ki, asan yolla qənimət** (islamda vaqe olan fəthlərin qəniməti) **əldə edəsiniz. (فَعَجَّلَ لَكُمْ هٰذِهٖ وَكَفَّ اَيْدِيَ النَّاسِ عَنْكُمْ) -Allah-Təala** (Xeybər) **qənimətini sizə tez verdi və (Xeybər) əhlinin əllərini sizə qalib olmaqdan saxladı. Ta ki, siz onlara qalib olub qənimət əldə edəsiniz. (وَلِتَكُونَ اٰيَةً لِلْمُؤْمِنِينَ وَيَهْدِيَكُمْ صِرَاطًا مُسْتَقِيمًا) - Və Allah-Təala sizi** (Xeybər) **əhlinə qalib edir ki, həm qənimət aparasınız və həm də bu, möminlərdən ötrü Allah-Təalanın qüdrət və əzəmətinə dəlil və sübut olub ibrət alsınlar və Allah-Təala sizi öz yolunda** (İslam dinində) **sabit və bərqərar edib bəsirət və inancınızı artırsın.** (Xeybər savaşının hekayəsi müxtəsər şəkildə belədir. Xeybər bir-birinin daxilində hər birinin xüsusi adı olan bir neçə qaladan ibarət idi, lakin hamısına birdən Xeybər deyilirdi. O qalaların əhli yəhudilər idi. Onlar dəfələrlə müsəlmanlara əziyyət etmişdilər. Axırda peyğəmbər onların verdiyi əziyyətdən bezib, Hüdeybiyyədə Məkkə əhli ilə sülh bağlayıb, Mədinəyə qayıdandan sonra zilhiccə ayının sonu, Məhərrəm ayının əvvəlində Mədinədə dincələndən sonra orduya Xeybər tərəfə hərəkət etməyi əmr etdi. Sübh vaxtı gedib Xeybərə çatdılar. Elə ki, Xeybər əhli xəbərdar oldu, qalalarında qapanıb qaldılar. Təfsirçi Bəğəvinin rəvayətinə görə peyğəmbər fəth və qələbə bayrağını Əbu Bəkrə verib onu orduya sərkərdə təyin etdi. O biri tərəfdən

yəhudilərin sərkərdəsi Mərhəb olub, savaş oldu. İslam ordusu məğlub olub, Əbu Bəkir geri qayıtdı. Ondan sonra peyğəmbər Öməri sərkərdə təyin eylədi. O da gedib şiddətlə savaşsa da, taqətdən düşüb geri qayıtdı. Necə ki, fəzilətli İbn Əbil-Hədid "Fəthi-Xeybər" qəsidəsində deyir:

"Hər nəyi unutsam, unutmaram mən,

Qaçmaq günah ikən qaçdınız səhnədən".

Bəğəvi deyir: "Ondan sonra Allahın Rəsulu buyurdu: "Sabahkı gün fəth və qələbə bayrağını elə bir kişiyə verəcəyəm ki, o, Allah-Təalanı və onun peyğəmbərini sevir, Allah-Təala və onun peyğəmbəri də onu sevir. Allah-Təala onun əli ilə fəthi qismət edənə qədər cihaddan geri dönməz. O gecə səhabələr yata bilmədi, görəsən bu fəzilət kimə qismət olacaq? Səhabələrin hamısı cəm olub, peyğəmbərin fərmanını gözlədikləri halda səhər oldu. Buyurdu ki, Əli haradadır? Dedilər: "Ey peyğəmbər, gözləri ağrıyır. Buyurdu: "Gətirin. Əlini gətirdilər. Bayrağı o cənaba verib buyurdu: "Heç bir şeyə fikir vermədən get, ta ki, Allah-Təala sənin əlinlə Xeybəri fəth etsin. Əli cənabları gözləri ağrıya-ağrıya təkbətək döyüşə getdi, o tərəfdən Mərhəb başına daşdan bir dəbilqə* qoyub, Əlinin yanına gəlib bu qəsidəni söylədi:

"Artıq Xeybər tanıdı, bildi ki, Mərhəbəm mən!

Müharibə başlayıb, döyüş alovlanarkən,

Mahir silah ustası, təcrübəli ərəm mən!"

Bu tərəfdən Əli həzrətləri ona cavab verib bu qəsidəni dedi:

"Anamın Heydər (aslan) adlandırdığı mənəm,

Meşələr aslanı tək zəhmli görkəmliyəm,

Düşmənləri pərən-pərən edib tez öldürərəm!"

Ondan sonra Mərhəbə həmlə edib, qılıncı Mərhəbin başına vurdu. Qılınc daşdan olan dəbilqəni yarıb, başını ayırıb dişlərinə qədər çatdı. Elə ki, Əli Mərhəbi qətl etdi, Xeybər fəth olundu. Necə ki İbn Əbil-Hədid adı çəkilən qəsidəsində deyir:

"Qırx dörd əlin aça bilmədiyini

Ey qoparıb atan qəhrəman Əli".

Xeybər əhlindən Səllam ibn Mişkəmin xanımı Zeynəb ibn Haris qızı Xeybər fəth olunandan sonra müsəlmanlardan soruşdu: "Görəsən, peyğəmbər qoyunun hansı hissəsini çox istəyir. Dedilər: "Qol hissəsini". Zeynəb gedib, bir qoyundan kabab hazırlayıb, ona zəhər qatdı. Qol hissəsinə hamısından çox zəhər qatdı, peyğəmbərə hədiyyə gətirdi. Peyğəmbərin yanında səhabədən Bişr

وَاُخْرٰى لَمْ تَقْدِرُوا عَلَيْهَا قَدْ اَحَاطَ اللّٰهُ بِهَاۜ وَكَانَ اللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ قَد۪يرًا ﴿٢١﴾ وَلَوْ قَاتَلَكُمُ الَّذ۪ينَ كَفَرُوا لَوَلَّوُا الْاَدْبَارَ ثُمَّ لَا يَجِدُونَ وَلِيًّا وَلَا نَص۪يرًا ﴿٢٢﴾ سُنَّةَ اللّٰهِ الَّت۪ي قَدْ خَلَتْ مِنْ قَبْلُۚ وَلَنْ تَجِدَ لِسُنَّةِ اللّٰهِ تَبْد۪يلًا ﴿٢٣﴾ وَهُوَ الَّذ۪ي كَفَّ اَيْدِيَهُمْ عَنْكُمْ وَاَيْدِيَكُمْ عَنْهُمْ بِبَطْنِ مَكَّةَ مِنْ بَعْدِ اَنْ اَظْفَرَكُمْ عَلَيْهِمْۜ وَكَانَ اللّٰهُ بِمَا تَعْمَلُونَ بَص۪يرًا ﴿٢٤﴾

---

ibn Bəra ibn Mərur da var idi. Allahın Rəsulu qoyunun qol hissəsindən bir tikə kəsib, ağzına qoydu. Bişr də bir tikə kəsib, yeməyə başladı. Bişr həmin tikəni uddu, amma peyğəmbər bir qədər çeynəyəndən sonra həmin tikəni ağzından çıxarıb dedi: “Bu qol mənə xəbər verir ki, ona zəhər qatıblar. Həmin qadını (Zeynəbi) gətirdilər. Peyğəmbər soruşdu: “Səni buna nə vadar etdi? Dedi: “Ey peyğəmbər, fikirləşdim ki, əgər bu kişi padşahdırsa, bu zəhərlə həlak olar, biz də ondan xilas olarıq, amma peyğəmbər isə zəhərdən xəbəri olar, biz də ona iman edərik. Ondan sonra o qadın iman etdi. Lakin Bəşir həmin zəhirdən şəhid oldu. İbn Əbil-Hədid mötəzilə alimlərindən olub, hərçənd əmirəl-möminin Əliyə olan məhəbbətdə mübaliğə edənlərdəndir. Lakin Xeybər savaşında necə ki, qeyd edibdir, o cənabın hünər və şücaəti və Mərhəbi qətl edib, islama nicat verməsi həqiqi bir hadisədir. Amma İbn Əbil-Hədidin Əbu Bəkir və Ömərə tənə etməsi mənasızdır. Çünki əmirəl-möminin Əlidə olan şücaət onlarda olmayıb, Mərhəbin qarşısında durmaları çətin olduğuna görə qaçmağa məcbur oldular).

**21) (وَاُخْرٰى لَمْ تَقْدِرُوا عَلَيْهَا قَدْ اَحَاطَ اللّٰهُ بِهَاۜ وَكَانَ اللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ قَد۪يرًا) - Başqa qənimətlər də olacaqdır ki, siz onlara qadir olmazsınız. Lakin həqiqətən, Allah-Təala onları ehtiva edib sizi o qənimətə* sahib edəcəkdir. Allah-Təala hər bir şeyə qadirdir.**

**(*Qeyd:** *“Bu qənimət Hüneyn savaşında olan qənimətdir ki o savaş Məkkədən sonra vaqe oldu. O savaşda əvvəlcə müsəlmanlar məğlub oldu, ondan sonra Allah-Təala onlara qüvvət verib yenidən qalib oldular. Bu savaşın təfsilatı Bəraət (Tövbə) surəsində qeyd olundu. Oraya baxılsın).*

**22) (وَلَوْ قَاتَلَكُمُ الَّذ۪ينَ كَفَرُوا لَوَلَّوُا الْاَدْبَارَ ثُمَّ لَا يَجِدُونَ وَلِيًّا وَلَا نَص۪يرًا) - Ey müsəlmanlar, heç vaxt kafir və müşriklərdən qorxmayın, əgər sizinlə savaşsalar, hər halda sizə arxa çevirib qaçacaqlar. Qaçandan sonra özlərindən ötrü nə bir dost, nə də bir kömək tapmazlar.**

**23) (سُنَّةَ اللّٰهِ الَّت۪ي قَدْ خَلَتْ مِنْ قَبْلُۚ وَلَنْ تَجِدَ لِسُنَّةِ اللّٰهِ تَبْد۪يلًا) - Allah-Təalanın əvvəldən qoyduğu qayda-qanun budur ki, gərək peyğəmbərlərini düşmənə qalib etsin, əlbəttə sən** (ey Məhəmməd), **Allah-Təalanın qayda-qanununda dəyişiklik tapmazsan. Səni də düşmənlərə qalib edəcəkdir.**

**24) (وَهُوَ الَّذ۪ي كَفَّ اَيْدِيَهُمْ عَنْكُمْ وَاَيْدِيَكُمْ عَنْهُمْ بِبَطْنِ مَكَّةَ مِنْ بَعْدِ اَنْ اَظْفَرَكُمْ عَلَيْهِمْۜ وَكَانَ اللّٰهُ بِمَا تَعْمَلُونَ بَص۪يرًا) -Allah-Təala öz kamil qüdrəti ilə Məkkəni fəth edib, siz mö-**

هُمُ الَّذِينَ كَفَرُوا وَصَدُّوكُمْ عَنِ الْمَسْجِدِ الْحَرَامِ وَالْهَدْيَ مَعْكُوفًا اَنْ يَبْلُغَ مَحِلَّهُ ۚ وَلَوْلَا رِجَالٌ
مُؤْمِنُونَ وَنِسَاءٌ مُؤْمِنَاتٌ لَمْ تَعْلَمُوهُمْ اَنْ تَطَؤُهُمْ فَتُصِيبَكُمْ مِنْهُمْ مَعَرَّةٌ بِغَيْرِ عِلْمٍ ۚ لِيُدْخِلَ اللّٰهُ فِي
رَحْمَتِهِ مَنْ يَشَاءُ ۚ لَوْ تَزَيَّلُوا لَعَذَّبْنَا الَّذِينَ كَفَرُوا مِنْهُمْ عَذَابًا اَلِيمًا ﴿٢٥﴾

---

**minləri Məkkə əhlinə qalib edəndən sonra, Məkkənin içində olduğunuz halda sizin əlinizi Qüreyşdən və Qüreyşin əllərini sizdən saxlayıb savaşmanıza mane oldu. Allah-Təala sizin hər bir əməllərinizi görüb biləndir.**

**25)** (هُمُ الَّذِينَ كَفَرُوا وَصَدُّوكُمْ عَنِ الْمَسْجِدِ الْحَرَامِ وَالْهَدْيَ مَعْكُوفًا اَنْ يَبْلُغَ مَحِلَّهُ) - (Ey Məhəmməd), **Məkkə əhli o şəxslərdir ki, küfr və şirklərində sabit olub sizin Məscidül-harama** (Kəbəyə) **daxil olmanıza mane olub, qurbanlıqları da əsl məkanına** (Minaya) **çatıb kəsilməyə qoymadılar və Hüdeybiyyədən sizi qaytardılar.**

(وَلَوْلَا رِجَالٌ مُؤْمِنُونَ وَنِسَاءٌ مُؤْمِنَاتٌ لَمْ تَعْلَمُوهُمْ اَنْ تَطَؤُهُمْ فَتُصِيبَكُمْ مِنْهُمْ مَعَرَّةٌ بِغَيْرِ عِلْمٍ) **- Əgər Məkkədə sizin bilmədiyiniz mömin kişilər və qadınlar olmayıb, sizin də onları qətl etməniz səbəbi ilə məşəqqət və pisliyə düçar olma ehtimalınız olmasaydı, hər halda Allah-Təala sizi savaşmaqdan saxlamazdı. Bəlkə sizi Məkkə əhlinə hakim edib hamısını qətl edərdiniz.**

(لِيُدْخِلَ اللّٰهُ فِي رَحْمَتِهِ مَنْ يَشَاءُ) **Allah-Təala sizi Məkkə əhlini qətl etməkdən bu səbəbə görə saxladı ki, istədiyinə yardım edib islama daxil etsin.**

(لَوْ تَزَيَّلُوا لَعَذَّبْنَا الَّذِينَ كَفَرُوا مِنْهُمْ عَذَابًا اَلِيمًا) **- Əgər Məkkədə olan möminlər kafirlərdən fərqlənib, sizdən ötrü məlum olsaydı, hər halda sizi onlardan kafir olanlara hakim edib, onlara sizin əlinizlə əziyyət verən əzab verərdik.** (Hüdeybiyyənin qissəsi müxtəsər şəkildə belədir ki, bəhs olunur, hicrətin 7-ci ilində Peyğəmbər (ə.s) səhabələrlə birlikdə Mədinədən Kəbəni ziyarət etmək üçün çıxıb, 70 dəvə də qurban etmək üçün gətirdi. Elə ki, Zülhüleyfəyə, Şəcərə məscidinə çatdılar, Allahın Rəsulu dəvələrin hürgücünü bir az kəsib, qanını üzünə sürtüb və bu niyyətlə bu şeyi qurbanlıqdan ötrü əlamət etdi. Qurbanlığı bu şəkildə eləməyə "iş`ar və təqlid" deyilir. Qurbanlığa bu əlamətləri qoymaqdan məqsəd ərəblərin şərindən o heyvanları mühafizə etmək idi. Çünki Kəbənin qurbanlığı hər bir halda toxunulmaz idi. Ondan sonra peyğəmbər (ə.s) ümrədən ötrü ehrama girib yola düşdü. Özündən əvvəl Xüzaə camaatından bir nəfəri göndərdi ki, Qüreyşdən ona xəbər gətirsin. Allahın Rəsulu xeyli yol gedib, axırda Qədirül-əştat adlı yerə çatdı. Orada Xüzaə camaatından Utbə adlı bir şəxs gəlib peyğəmbərə ərz etdi ki, Qüreyş camaatı və Məkkə ətrafında olan Əhabiş camaatı toplanıb, sənin Məkkəyə daxil olmana mane olub səninlə savaşacaqlar. Peyğəmbər səhabələrlə məşvərət edib dedi: "Ey insanlar, bu barədə rəy verin. Əbu Bəkrə dedi: "Kəbəyə gedək? Əgər bizə mane olsalar, ancaq o zaman savaşarıq. Ya da ki, əvvəlcə Qüreyşə kömək olan Əhabiş qəbiləsinə hücum edib, onları əsir edək? Əbu Bəkir dedi:

“Ey peyğəmbər, sən beytullahın (Kəbənin) ziyarətinə gəlibsən, heç bir nəfərlə savaşmaq niyyətin yoxdur. Sən Kəbəyə yönəl, kim ki, bizə mane olsa, o vaxt onlarla savaşarıq. Allahın Rəsulu buyurdu: “Allah-Təalanın adı ilə yola düşək. Ondan sonra buyurdu: Xalid ibn Vəlid Qamim adlı yerdə Qüreyşin bir dəstə atlısıyla bizi gözləyir. Sağ tərəfdən gedin. Ondan sonra buyurdular: “And olsun Allah-Təalaya ki, mənim nəfsim onun qüdrətinə tabedir, hər bir əmr ki, Allah-Təalaya ehtiramı, təzimi və qohumluq bağını ehtiva etmiş ola və Qüreyş məni o əmrə dəvət etsə, mən o əmri qəbul edərəm. Ondan sonra xeyli gedib, axırda Hüdeybiyyəyə çatıb, orada dayandılar. Orada Xüzaə qəbiləsindən Büdeyl ibn Vərqa bir neçə nəfərlə peyğəmbərin hüzuruna gəldi. Xüzaə qəbiləsinin müşrik və möminlərinin hamısı peyğəmbərə müttəfiq olub, kömək etmək üçün and içib əhd etmişdilər. Büdeyl ərz etdi: “Ey peyğəmbər, Qüreyşlilər səninlə savaşıb, sənin Kəbəyə getmənə mane olmaq üçün toplanıblar. Allahın Rəsulu (ə.s) buyurdu: “Biz heç bir nəfərlə savaşmağa gəlməmişik, bəlkə ümrədən ötrü ehrama girib, Kəbəyə ziyarətə gəlmişik. Qüreyş camaatı savaşmaqdan zərər və zillətə düşübdür. Əgər istəsələr onlarla əhd bağlayıb, aramızda savaşın olmaması üçün vaxt təyin edərəm. Ya mənimlə digər qəbilələrin arasından çəkilsinlər, ya da əgər istəsələr, imana daxil olan digər şəxslər kimi onlar da gəlib imana daxil olsunlar. Əgər bunların heç birini etməyib, savaşmaq istəsələr, and olsun Allah-Təalaya ki, mənim nəfsim onun qüdrətinə tabedir, tək qalıb öldürülənə qədər onlarla cihad edərəm. Amma əlbəttə, Allah-Təala öz əmr və iradəsini zahir edib, məni onlara qalib edəcəkdir. Büdeyl ərz eylədi: “Ey peyğəmbər, mən gedib sənin sözlərini onlara çatdırım. Büdeyl gedib Qüreyş camaatına dedi: “Mən bu kişinin (peyğəmbərin) yanından sizin tərəfinizə gəlib, ondan bəzi sözlər eşitmişəm. Əgər istəsəniz o sözləri sizə çatdıraram. Qüreyşin səfehləri dedilər: “Onun sözlərinə ehtiyacımız yoxdur. Lakin Qüreyşin müdrikləri dedilər: “O sözləri eşidək, bəyan et. Büdeyl peyğəmbərdən eşitdiyi sözləri bir-bir bəyan etdi. Urvə ibn Məsud Səqəfi ayağa durub dedi: “Ey Qüreyş camaatı, bəs siz mənə ata kimi deyilsinizmi? Dedilər: “Bəli”. Dedi: “Bəs məni nədəsə günahkar bilirsinizmi? Dedilər: “Yox, bilmərik. Dedi: “Bəs, bilmirsiniz ki, mən Taif camaatından uzaqlaşıb, ailəmi və mənə itaət edənləri gətirib sizə gəlmişəm? Dedilər: “Belədir. (Bu kişi Taif əhlindən idi. Onlarla dalaşıb, gəlib Məkkədə yaşayırdı. Məşhur zənginlərdən idi). Dedi: “Bu kişi (yəni peyğəmbər) sizə doğrunu, hidayət yolunu göstərir, qəbul edin, mənə izin verin onun yanına gedim, sözlərini eşidim. Dedilər: “Get. Urvə gedib Allahın Rəsulu ilə danışıb, peyğəmbər Büdeylə dediyi sözləri ona da dedi. Urvə dedi: “Ey Məhəmməd, bəs sən istəyirsən, öz qövmün Qüreyşin kökünü kəsib, yer üzündən yox edəsən, heç eşidibsən ki, səndən qabaq ərəblərdən bir nəfər belə iş görsün? Bu ətrafında olanlarla qürurlanma, bunların üzlərinə mən baxıram, axırda səni qoyub qaçacaqlar. Əbu Bəkir onu söyüb dedi: “Biz onu qoyub qaçacağıq? Urvə dedi: “Bu şəxs kimdir? Dedilər:

## *Fəth surəsi*

Əbu Bəkirdir. Dedi: “Əgər sənin mənə bir yaxşılığın olmasaydı, sənə cavab verərdim. Nə vaxtsa Əbu Bəkir ona alış-verişdə kömək etmişdi. Müğirə ibn Şü`bə əlində qılınc peyğəmbərin başının üstündə dayanmışdı. Urvə peyğəmbərlə danışarkən əli ilə peyğəmbərin saqqalını tutub dartırdı. Müğirə qılıncın ucuyla onun əlinə vurub dedi: “Əlini yığışdır. Urvə başını yuxarı qaldırıb dedi: “Bu şəxs kimdir? Dedilər: “Müğirə ibn Şü`bədir. Dedi: “Hiyləbaz kişidir, ondan sonra Urvə səhabələrə diqqətlə baxıb, onların peyğəmbərə qarşı olan davranışına və sözlərinə fikir verib qayıdıb getdi. Elə ki, Qüreyş camaatına çatdı, dedi: “Ey camaat, and olsun Allah-Təalaya, mən padşahların hüzurunda, İran, Rum hökmdarlarının və Nəcaşinin hüzurlarında olmuşam. Heç bir padşah görməmişəm ki, Məhəmmədə səhabələrinin etdiyi ehtiram və təzim qədər ona hörmət etsinlər. And olsun Allah-Təalaya, ağzının suyu sıçrayanda ovuclarını açıb, o suyu tutub üzlərinə sürtürlər. Dəstəmaz suyunun üstündə bir-birləri ilə savaşırlar. Əmr edəndə hamısı o əmri yerinə yetirmək üçün tələsirlər. Danışanda səslərini ucadan çıxarmayıb, acizanə şəkildə danışırlar. Hörmətlərindən diqqətlə onun üzünə baxmırlar. Ey Qüreyş camaatı, Məhəmməd sizə doğrunu, hidayət yolunu göstərir, qəbul edin. Ondan sonra Bəni-Kinanə camaatından bir kişi Qüreyş camaatına dedi: “Mənə izin verin Məhəmmədin yanına gedim. İzin verdilər. Elə ki, peyğəmbər o kişini uzaqdan gördü, buyurdu: “Bunlar elə camaatdırlar ki, qurbanlıq dəvələrə təzim edərlər, dəvələri onun qabağına çıxarın. Dəvələri sürüb, Allahım, qəbul et! - deyə-deyə onun qabağına çıxdılar. O kişi dəvələri görən kimi dedi: “Allah böyükdür, bunları Kəbəyə buraxmamaq rəva deyildir. Oradan qayıdıb Qüreyş camaatına dedi: “işar və təqlid” olunmuş (işarətlənmiş) qurbanlıq dəvələri gördüm, bu halətlə onları Kəbəyə buraxmamağı mən doğru saymıram. Ondan sonra Qüreyş camaatı Məkkə ətrafında yaşayan Əbahiş camaatının rəisini - Hüleys ibn Əlqəməni peyğəmbərin yanına göndərdilər. Peyğəmbər onu görən kimi buyurdu: “Qurbanlıq dəvələri onun hüzuruna çıxarın ki, onları görsün. Hüleys baxıb gördü ki, ”işar və təqlid” olunmuş dəvələri qurbangaha (Minaya) aparmağa onlara mane olublar, peyğəmbəri görməyib, danışmamış qayıdıb Qüreyş camaatının yanına gedib dedi: “Ey Qüreyş camaatı, onu ki, mən gördüm, onlara mane olmaq halal deyildir. Qoy gəlib Kəbəni təvaf etsinlər. Dedilər: sən bədəvisən, belə şeyləri bilməzsən. Hüleys qəzəblənib dedi: “Ey Qüreyş camaatı, biz belə şeylərdə and içib sizinlə əhd etməmişik. O şəxslər ki, Kəbəyə təzim edib, onun ziyarətinə gəlib, onlara mane olmaq olarmı? And olsun o tanrıya ki, Hüleysin nəfsi onun qüdrətinə tabedir, gərək Məhəmməd ilə Kəbənin arasını açıb, ona mane olmayasınız, yoxsa Əhabiş camaatını götürüb sizdən uzaqlaşacam. Dedilər: “Ey Əhabiş, sakit ol. Gəl o işi seçək ki, hamımız ona razı olaq. Bu əsnada Əhabişdən Mikrəz ibn Həfs adlı bir kişi ayağa durub dedi: “Mənə izin verin, Məhəmməd yanına gedim. İzin verdilər. Elə ki, peyğəmbər onu gördü, buyurdu: “Bu Mikrəz ibn Həfs şərir kişidir. Gəlib

peyğəmbərlə danışmağa başladı. O əsnada ki danışırdılar, Qüreyş camaatının böyüklərindən Süheyl ibn Əmr gəldi. Onu görəndə peyğəmbər buyurdu: “İşiniz asanlaşdı. Süheyl gəlib dedi: “Əmr et ki, kağız yazılsın. Peyğəmbər (ə.s) Əli ibn Əbu Talibi çağırıb buyurdu ki, yaz: “Bismillahir-Rəhmanir-Rəhim. Süheyl dedi: “And olsun Allah-Təalaya ki, mən bilmirəm, Rəhman nə olan şeydir, belə yaz: “Bismikəllahümmə (Allahın adı ilə), necə ki, bundan əvvəl yazırdıq. Müsəlmanlar dedilər: “Elə yazmarıq. Peyğəmbər buyurdu: “Ey Əli, yaz: “Bismikəllahümmə. Ondan sonra buyurdu: “Yaz ki, bu, bir hökmdür, Məhəmməd Rəsulüllah buna hökm edir. Süheyl dedi: “Əgər biz səni peyğəmbər saysaqdıq, Kəbəyə getməyə sənə mane olmazdıq və səninlə savaşmazdıq, yaz ki, Məhəmməd ibn Abdullah. Peyğəmbər buyurdu: “Hərçənd siz məni təkzib etsəniz də, mən peyğəmbərəm, ey Əli, yaz: “Məhəmməd ibn Abdullah. Əli ibn Əbu Talib kağıza belə yazdı: “Məhəmməd ibn Abdullah və Süheyl ibn Əmr bu şəkildə hökm etdilər ki, onların arasında 10 il savaş olmayıb, insanlar bir-birindən amanda olsunlar. Allahın Rəsulu buyurdu: “Yazın ki, beytullahı (Kəbəni) təvaf etməmizə indi mane olmayacaqsınız. Süheyl dedi: “Bu, ola bilməz, ərəblər desinlər ki, zorla gəlib, Məkkəyə daxil olub, Kəbəni təvaf etdiniz, lakin gələn il gəlib təvaf edərsiniz. Belə də yazıldı. Süheyl dedi: “Yazılsın ki, bizlərdən gəlib Mədinəyə sənin dininə daxil olanları bizə qaytaracaqsan. Müsəlmanlar dedilər: “Bu, olan iş deyil, islama girən şəxsi müşriklərə qaytarmaq olmaz. Həmin Süheylin oğlu Əbu Cəndəl müsəlman olub atası onu Məkkədə zəncirlə bağlamışdı. Bu söhbət əsnasında zəncir boynunda Məkkənin aşağı tərəfindən qaçıb gəlib, özünü müsəlmanların arasına saldı. Süheyl xəbərdar olub dedi: “Ey Məhəmməd, bu ilk hökmdür, gərək oğlumu mənə qaytarasan. Peyğəmbər buyurdu: “Biz hələ kağızı yazıb bitirməmişik. Süheyl dedi: “Belə olanda mən səninlə sülh etməyəcəm. Peyğəmbər buyurdu: “Onu mənə bağışla. Dedi: “Bağışlamaram. Dedi: xahiş edirəm. Süheyl dedi: “Qəbul etmirəm. Ayağa durub oğlu Əbu Cəndəlin əlindən yapışdı ki, aparsın. Əbu Cəndəl fəryad etdi: “Ey müsəlmanlar, bəs məni müşriklərə verirsiniz, mənə əzab edirlər. Peyğəmbər buyurdu: “Səbir et, Allah-Təala sənə nicat verər. Ömər ibn Xəttab Əbu Cəndəlin yanında durub yavaşca ona deyirdi: “Əbu Cəndəl, səbir et, bu müşriklərin qanı it qanı kimidir, bu sözü deyib qılıncı ona tərəf uzadırdı ki, bəlkə qılıncı alıb atasını qətl edə. Ömər deyir: “Mən istədim, qılıncı məndən alıb atasını qətl etsin, lakin atasını öldürməyə qıymadı. Sülh müqaviləsini bu şəkildə yazıb tamamladılar: “Müşriklərdən kim Mədinəyə, peyğəmbərin hüzuruna gedib müsəlman olsa, onu müşriklərə qaytarsınlar və müsəlmanlardan kim müşriklərin tərəfinə getsə, qaytarmasınlar, gələn il Məkkəyə gəlib, silahsız Məkkəyə daxil olub, 3 gün qalıb Kəbəni təvaf etsinlər. O 3 gündə Məkkə əhli şəhəri boşaldıb, kənara çəkilsinlər. Bu şəkildə müqaviləni yazıb, hər iki tərəf imzalayıb, bir nüsxəsini peyğəmbərə, digər nüsxəsini də Süheyl ibn Əmrə verdilər. Süheyl oğlunu götürüb getdi. Bu

mətləb müsəlmanlara çox ağır gəldi. Peyğəmbər Mədinədən çıxmadan qabaq səhabələrinə demişdi ki, Məkkəyə daxil olub Kəbəni təvaf etdiyimizi yuxuda gördüm. Peyğəmbərin bu yuxusuna görə müsəlmanların şübhəsi yox idi ki, Məkkəyə daxil olub Kəbəni təvaf edəcəklər. O zaman ki, məsələ sülhlə nəticələndi, təəccübləndilər. Ömər ibn Xəttab deyir: "And olsun Allah-Təalaya, o gündən ki, islama daxil olmuşdum, dinimdə şəkk etməmişdim, ancaq bu gün şəkk etdim. Peyğəmbərin hüzuruna gedib, ərz etdim: "Sən Allah-Təala tərəfindən haqq olan peyğəmbər deyilsənmi? Dedi: "Bəli, haqq peyğəmbərəm. Dedim: "Biz haqq, düşmənimiz batil deyilmi? Buyurdu: "Bəli, batildirlər. Dedim: "Bizim ölənimiz cənnətdə, onların ölənləri cəhənnəmdə deyilmi? Buyurdu: "Cəhənnəmdədirlər. Dedim: "Sən bizə demədin ki, Məkkəyə daxil olub Kəbəni təvaf edəcəyik. Buyurdu: "Bəs mən dedim ki, bu il təvaf edəcəksiniz? Ömər dedi: xeyir, bu il demədin. Buyurdu: "Əlbəttə, daxil olub təvaf edəcəksən. Ondan sonra Əbu Bəkrin yanına gedib həmin sözləri ona dedi. Əbu Bəkir dedi: "Ya Ömər, Məhəmməd haqq peyğəmbərdir. Sən Məkkəyə daxil olub Kəbəni təvaf edəcəksən. Bu sözlərdən sonra Ömərin qəlbi sakitləşdi. Lakin gələn il Məkkəyə gedib Kəbəni təvaf edənə kimi qəlbi rahat olmadı. Sülh bağlandıqdan sonra peyğəmbər buyurdu: "Dəvələri qurban kəsib, başınızı qırxıb, ehramdan çıxın. Bu iş müsəlmanlara son dərəcə ağır gəldi. Çünki qurbanlıqlar gərək Minada kəsiləydi. Heç bir nəfər qurban kəsmədi. Peyğəmbər möminlərin anası Ümmü Sələmənin çadırına gedib müsəlmanlardan şikayət etdi. Ümmü Sələmə ərz etdi: "Ey peyğəmbər, sən özün bu dəvələri kəsib, öz başını da qırx. Heç kimə də heç nə demə. Elə ki səni, qurban kəsib, baş qırxan gördülər, hamısı buna əməl edərlər. Peyğəmbər o şəkildə də etdi. Elə ki, müsəlmanlar peyğəmbərin qurban kəsib, öz başını qırxdığını gördülər, qəzəbdən az qala bir-birlərini öldürəcək halda olsalar da, hamısı bu şəkildə əməl etdi. Peyğəmbər qayıdıb Mədinəyə getdi. Bir müddətdən sonra Məkkədə müsəlman olan şəxslərdən Əbu Bəsir ləqəbli Utbə ibn Əsid qaçıb Mədinəyə getdi. Qüreyş camaatı onun dalınca adam göndərdilər. Peyğəmbərin hüzuruna gedib dedilər: "Bizimlə bağladığın əhdə vəfa elə. Peyğəmbər Əbu Bəsirə dedi: "Biz bu camaatla əhd etmişik, əhdimizi pozmarıq, Məkkəyə qayıt, Allah-Təala sənə nicat verər. Əbu Bəsiri o iki nəfərə tapşırıb yola saldı. Mədinədən çıxıb, Şəcərə məscidinə çatıb, orada yemək yeməyə başladılar. Əbu Bəsir o iki müşrikin birinə dedi: "Sənin bu qılıncın çox yaxşı qılınca oxşayır. Müşrik - bəli deyib, qılıncı çəkdi, sonra dedi: "Mən bu qılıncı neçə dəfə imtahan eləmişəm, təcrübədən çıxıbdır. Əbu Bəsir dedi: "Mənə ver baxım, qılıncı alıb müşrikin başına vurub, başı yerə düşdü. O birisi qaçıb Mədinəyə gedib məsciddə peyğəmbərin hüzuruna daxil oldu. Peyğəmbər onu uzaqdan görən kimi dedi: "Bu şəxs qorxubdur. O, peyğəmbərin yanına gedib, əhvalatı ona nəql etdi. Bu zaman Əbu Bəsir gəlib, ərz etdi: "Ey peyğəmbər, sən əhdinə vəfa etdin, lakin Allah-Təala mənə nicat verdi. Allahın

إِذْ جَعَلَ الَّذِينَ كَفَرُوا فِي قُلُوبِهِمُ الْحَمِيَّةَ حَمِيَّةَ الْجَاهِلِيَّةِ فَاَنْزَلَ اللّٰهُ سَكِينَتَهُ عَلٰى رَسُولِهِ وَعَلَى الْمُؤْمِنِينَ وَاَلْزَمَهُمْ كَلِمَةَ التَّقْوٰى وَكَانُوا اَحَقَّ بِهَا وَاَهْلَهَا وَكَانَ اللّٰهُ بِكُلِّ شَيْءٍ عَلِيمًا ﴿٢٦﴾ لَقَدْ صَدَقَ اللّٰهُ رَسُولَهُ الرُّءْيَا بِالْحَقِّ لَتَدْخُلُنَّ الْمَسْجِدَ الْحَرَامَ اِنْ شَٓاءَ اللّٰهُ اٰمِنِينَ مُحَلِّقِينَ رُؤُسَكُمْ وَمُقَصِّرِينَ لَا تَخَافُونَ

---

Rəsulu buyurdu: "Əbu Bəsirin köməlçisi olsa, dava-dalaş salan adamdır. Bu sözdən Əbu Bəsir anladı ki, peyğəmbər ona Mədinədə qalmağa izin verməyəcəkdir. Oradan çıxıb, gedib Ciddəyə yaxın dəniz kənarında məskən saldı. Məkkədə olan müsəlmanlar bir-bir qaçıb, gedib Əbu Bəsirin yanına toplandılar. Süheyl ibn Əmrin oğlu Əbu Cəndəl də qaçıb Əbu Bəsirin yanına getdi. Bir neçə nəfər bir yerə cəm olub Qüreyşin Şama gəlib-gedən karvanını qarət edib, karvandakıları qətl edirdilər. Axırda Qüreyş camaatı peyğəmbərə xəbər göndərdi ki, bu şərtdən keçdik, onları Mədinəyə çağır. Peyğəmbər onlara izin verib, Mədinəyə gəldilər. Ondan sonra Xeybər savaşı oldu).

**26) (إِذْ جَعَلَ الَّذِينَ كَفَرُوا فِي قُلُوبِهِمُ الْحَمِيَّةَ حَمِيَّةَ الْجَاهِلِيَّةِ)** - (Ey Məhəmməd), **o zaman ki, kafir olan Qüreyş camaatı cahiliyyə təəssübü və təkəbbürü kimi qəbilələrindəki təkəbbür və təəssübə qapılıb sizin Məkkəyə daxil olmanıza mane oldular, Hüdeybiyyədən qayıtdınız.**

**(فَاَنْزَلَ اللّٰهُ سَكِينَتَهُ عَلٰى رَسُولِهِ وَعَلَى الْمُؤْمِنِينَ) - Allah-Təala peyğəmbərinə** (Məhəmmədə) **və möminlərə təmkin və vüqar göndərdi ki, sülhə razı olub Qüreyşlə savaşmayasınız. (وَاَلْزَمَهُمْ كَلِمَةَ التَّقْوٰى وَكَانُوا اَحَقَّ بِهَا وَاَهْلَهَا) - Allah-Təala təqva kəlməsini (tövhidi) möminlər üçün elə vacib etdi ki, əsla ondan aralanmazlar, möminlər təqva kəlməsinə (tövhidə) layiq olub onun əhli idilər. (وَكَانَ اللّٰهُ بِكُلِّ شَيْءٍ عَلِيمًا) Allah-Təala hər bir şeyə agah olub insanların faydası üzrə iş görər.**

**27) (لَقَدْ صَدَقَ اللّٰهُ رَسُولَهُ الرُّءْيَا بِالْحَقِّ) - Həqiqətən, Allah-Təala peyğəmbərin** (Məhəmmədin) **yuxusunu** (hansı ki, yuxuda gördü ki, möminlər ilə Kəbəni təvaf edir) **haqq olduğu halda doğru edib, əlbəttə vaqe olacaqdır.** (Necə ki, vaqe oldu).

**(لَتَدْخُلُنَّ الْمَسْجِدَ الْحَرَامَ اِنْ شَٓاءَ اللّٰهُ اٰمِنِينَ مُحَلِّقِينَ رُؤُسَكُمْ وَمُقَصِّرِينَ لَا تَخَافُونَ) - Peyğəmbərimiz yuxuda görüb sizə dedi: "Ey möminlər, əlbəttə qorxmayıb, əgər Allah-Təala istəsə* əmin və xatircəm olduğunuz halda Məscidül-harama daxil olub, Kəbəni təvaf edib, başınızı qırxıb və** (saçınızı) **qısaldarsınız.** (Yəni sizlərdən bəzisi başını tamamən qırxıb, bəziləri də saçından bir qədər kəsdirər, bunların hər biri ehramdan çıxmağa kifayət edər).

فَعَلِمَ مَا لَمْ تَعْلَمُوا فَجَعَلَ مِنْ دُونِ ذٰلِكَ فَتْحًا قَرِيبًا ﴿٢٧﴾ هُوَ الَّذِيٓ اَرْسَلَ رَسُولَهُ بِالْهُدٰى وَدِينِ
الْحَقِّ لِيُظْهِرَهُ عَلَى الدِّينِ كُلِّهِۜ وَكَفٰى بِاللّٰهِ شَهِيدًاۜ ﴿٢٨﴾ مُحَمَّدٌ رَسُولُ اللّٰهِۜ وَالَّذِينَ مَعَهُٓ اَشِدَّٓاءُ عَلَى
الْكُفَّارِ رُحَمَٓاءُ بَيْنَهُمْ تَرٰيهُمْ رُكَّعًا سُجَّدًا يَبْتَغُونَ فَضْلًا مِنَ اللّٰهِ وَرِضْوَانًاۘ سِيمَاهُمْ فٖي وُجُوهِهِمْ
مِنْ اَثَرِ السُّجُودِۜ ذٰلِكَ مَثَلُهُمْ فِي التَّوْرٰيةِۚ وَمَثَلُهُمْ فِي الْاِنْجِيلِۚ كَزَرْعٍ اَخْرَجَ شَطْـَٔهُ فَاٰزَرَهُ فَاسْتَغْلَظَ
فَاسْتَوٰى عَلٰى سُوقِهٖ يُعْجِبُ الزُّرَّاعَ لِيَغٖيظَ بِهِمُ الْكُفَّارَۜ

---

(فَعَلِمَ مَا لَمْ تَعْلَمُوا فَجَعَلَ مِنْ دُونِ ذٰلِكَ فَتْحًا قَرِيبًا) - **Sizin bilmədiyiniz şeyə Allah-Təala agah olub sizdən ötrü** (Hüdeybiyyədə) **sülh yaratdı. Məkkənin fəthini təxirə salıb, daha yaxın bir zamanda sizdən ötrü** (Xeybər) **fəthini təyin etdi. Məkkənin fəthində əlbəttə, Məkkəyə daxil olub Kəbəni təvaf edəcəksiniz.**

(***Qeyd:** *Beytullah (Kəbəni) 4 tərəfdən əhatə edən binaya Məscidül-haram deyilir. Müsəlmanlar üçün ən fəzilətli məsciddir*).

**28)** (هُوَ الَّذِيٓ اَرْسَلَ رَسُولَهُ بِالْهُدٰى وَدِينِ الْحَقِّ لِيُظْهِرَهُ عَلَى الدِّينِ كُلِّهِۜ وَكَفٰى بِاللّٰهِ شَهِيدًاۜ) - **Allah-Təala peyğəmbəri (Məhəmmədi) hidayət və haqq dini ilə göndərdi, ta ki, onu hər bir batil dinə qalib edib hamısından uca etsin.** (Necə ki, etdi). **Allah-Təala peyğəmbəri** (Məhəmmədin) **peyğəmbərliyinə şəhadət etməkdə təkcə özü kifayət edər.**

**29)** (مُحَمَّدٌ رَسُولُ اللّٰهِۜ وَالَّذِينَ مَعَهُٓ اَشِدَّٓاءُ عَلَى الْكُفَّارِ رُحَمَٓاءُ بَيْنَهُمْ) - **Məhəmməd Allah-Təalanın peyğəmbəridir, insanlara göndəribdir və ona iman edənlər, onun səhabələri İslam dinini yaymaqda kafir və müşriklərə qarşı şiddətli və sərtdirlər. Lakin öz aralarında isə bir-birilərinə* qarşı mərhəmətli və mehriban olub, aralarında heç bir kin və ədavət zahir olmaz.)**

(سِيمَاهُمْ فٖي وُجُوهِهِمْ مِنْ اَثَرِ السُّجُودِۜ) - **İtaət etmələrinin əlaməti üzlərində səcdə əsərinin zahir və aşkar olmasıdır.**

( تَرٰيهُمْ رُكَّعًا سُجَّدًا يَبْتَغُونَ فَضْلًا مِنَ اللّٰهِ وَرِضْوَانًاۘ) - **Ey möminlərə baxan şəxs, onları üzlərindəki səcdə izi zahir və aşkar olduğu halda çox rüku və səcdə edən** (haqqa itaət edən) **görərsən.** (ذٰلِكَ مَثَلُهُمْ فِي التَّوْرٰيةِۚ وَمَثَلُهُمْ فِي الْاِنْجِيلِۚ) - **Möminlərin bu vəsfləri həmin vəsflərdir ki, Tövrat və İncildə də qeyd olunubdur.**

(كَزَرْعٍ اَخْرَجَ شَطْـَٔهُ) - **Möminlərin məsəli əkin kimidir. Hansı ki, o əkin cücərib, zahir olub,** (فَاٰزَرَهُ فَاسْتَغْلَظَ فَاسْتَوٰى عَلٰى سُوقِهٖ يُعْجِبُ الزُّرَّاعَ) - **zahir olandan sonra ona qüvvət gələr, o da qüvvət tapıb böyüyər, gövdəsi üstündə durub gözəl vəchlə hasil olmasına əkinçilər baxanda onları heyran edər.**

(لِيَغٖيظَ بِهِمُ الْكُفَّارَ) - **Allah-Təala möminlərə o əkin kimi qüvvət verib çoxaldar, ta ki, bu səbəbdən kafir və müşrikləri qəzəbləndirsin.** (Elə ki, Al-

lahın Rəsulu və möminlərin işləri çox tərəqqi edirdi, kafirlər qəzəblənib, kin və ədavətləri daha da artırdı).

**(وَعَدَ اللّٰهُ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ مِنْهُمْ مَغْفِرَةً وَاَجْرًا عَظِيمً)** - (Qurana) **iman edib, xeyir əməl edənlərə Allah-Təala bağışlanmaq və böyük əcr-savab vəd edibdir.**

**(*Qeyd:** *"İslamın ilk dövründə möminlər belə xüsusiyyətlərə malik idilər və bu səbəbdən yer kürəsinin əksər hissəsinə malik oldular. Bu xüsusiyyətlər haraya getdi? Necə oldu? Onların əvəzində kin, ədavət, xəsislik, nifaq zahir olub islam ümməti pərən-pərən olub, fəlakət və rəzalət gününə düşdülər. İlahi, islam ümmətinin arasına təfriqə salanların toxumunu yer üzündən yox et, amin!)*

**Allaha həmd olsun, Fəth surəsinin təfsiri tamamlandı. Birlik və ittifaqa, peyğəmbərin nə qədər şəfqətli şəkildə müşriklərlə rəftar etməyinə və sülhü istəyib, savaşdan çəkinməsinə, ancaq məcbur olduğu zamanlarda cihad etməyə işarə edən ayələri ehtiva edən mübarək bir surədir. Allahın Rəsulu buyurubdur: "Kim Fəth surəsini oxusa** (və anlasa), **sanki, Məkkənin fəthində iştirak etmiş kimi fəthin əcr və savabına nail olar.**

# əl-HUCURAT SURƏSİ

49-cu surədir. Mədinədə nazil olub, 18 ayə, 343 kəlmə və 1476 hərfdir.

يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا لَا تُقَدِّمُوا بَيْنَ يَدَيِ اللّٰهِ وَرَسُولِهِ

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا لَا تُقَدِّمُوا بَيْنَ يَدَيِ اللّٰهِ وَرَسُولِهِ) - Ey möminlər, Allah-Təalanın və onun peyğəmbərinin (Məhəmmədin) təyin etdiyi ehkamın* önünə keçməyib, onlara müxalif heç bir şeyə təşəbbüs etməyin. Hər bir işinizin barəsində ya gərək Allah-Təala tərəfindən nazil olan ehkama və ya peyğəmbərin** (ağlı ilə) **qərar verdiyi qanuna tabe olub əməl edəsiniz. Özünüzdən hökm vermək sizdən ötrü caiz deyildir. Allah-Təalaya və peyğəmbərə müxalif olmayın.**

**(*Qeyd:** *"Əgər islam ümməti bu ayəyə əməl etsəydilər, belə fəlakət günlərə düçar olmazdılar. Allah-Təalanın və peyğəmbərin verdiyi qanunlar qıraqda qalıb, nəfsani arzularla özlərindən ötrü ehkamlar təyin ediblər, o ehkamlar əsassız olduğu üçün heç bir işləri islah olunmayıb, nöqsan qalıbdır. Qurani-Şərifdə varid olan mübarək hökmlər və qanunlar, din və dünya işlərinə aid əmr və qadağalar necə də gizli qalıb, özgə millətlərin qanunlarına həsəd aparıb, onlardan qanun almağa çalışırıq, halbuki onların işlətdiyi qanunların əksəriyyəti Qurani-Şərifdən alınaraq dəyişdirilib. Bəs bu günkü gündə yer kürəsində beynəlxalq səviyyədə qəbul edilən şura, müşavirə, fikir birliyi, əksəriyyətin görüşünü qəbul etmə kimi prinsiplərlə iş görmək və digər məsələlər islam dininin qanunları deyilmi? Əfsus ki, din və dünya işlərinə dair belə bir kitab (Qurani-Şərif) bizim aramızda mövcud olarkən, onu tərk edib, özümüzü fəlakət və rəzalət gününə salıb, özümüzü özgə tayfaların nəzərində zəlil və rəzil, cahil və vəhşi əməllərə sahib bir camaat kimi göstəririk. Bizim bu zəmanəmizi və əməllərimizi haqqı görən nurlu baxışları ilə öncədən sezən uca peyğəmbərimiz müxtəlif məqamlarda Qurani-Şərifin qanunlarına tabe olub, ona bağlanmağı təbliğ etmiş, bilənlərin bilməyənlərə öyrətməsini də tövsiyə etmişdir. Necə ki, müxtəlif vasitələrlə bu xəbərlər bizə yetişibdir. Bizim islam alimlərinin əksəriyyəti Qurani-Şərifin müqəddəs bir kitab olub, onu ancaq Ramazanda, ya da ki, cənazə mərasimlərində və ya qəbristanda çürümüş sümüklərin üstündə oxumağın savab bir iş olmasını xalqa təbliğ ediblər. Ya həqiqətən, özləri də elə anlayıblar, ya da ki, dünya işlərinin xoş keçməsindən ötrü xalqa elə təlqin ediblər, yoxsa Qurani-Şərifin dini, dünyəvi və siyasi qanun kitabı olması gün kimi aydın bir əmrdir, lakin xalqın əksəriyyəti avam olduğuna görə elə rəislərə tabe olub, din və ümmət də məhv olubdur).*

وَاتَّقُوا اللّٰهَ ۜ اِنَّ اللّٰهَ سَمٖيعٌ عَلٖيمٌ ﴿١﴾ يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوا لَا تَرْفَعُٓوا اَصْوَاتَكُمْ فَوْقَ صَوْتِ النَّبِيِّ وَلَا
تَجْهَرُوا لَهُ بِالْقَوْلِ كَجَهْرِ بَعْضِكُمْ لِبَعْضٍ اَنْ تَحْبَطَ اَعْمَالُكُمْ وَاَنْتُمْ لَا تَشْعُرُونَ ﴿٢﴾ اِنَّ الَّذٖينَ يَغُضُّونَ
اَصْوَاتَهُمْ عِنْدَ رَسُولِ اللّٰهِ اُو۬لٰٓئِكَ الَّذٖينَ امْتَحَنَ اللّٰهُ قُلُوبَهُمْ لِلتَّقْوٰى ۜ لَهُمْ مَغْفِرَةٌ وَاَجْرٌ عَظٖيمٌ ﴿٣﴾

---

**(وَاتَّقُوا اللّٰهَ ۜ اِنَّ اللّٰهَ سَمٖيعٌ عَلٖيمٌ) - təqvalı olub Allah-Təalanın və onun peyğəmbərinin verdiyi hökmün önünə keçməyin. Həqiqətən, Allah-Təala sizin sözlərinizi eşidib, hər bir əməllərinizə agahdır.** (Allah-Təala növbəti ayədə peyğəmbərlə necə ədəblə danışmağı, necə rəftar etməyi möminlərə təlim edir).

**2) (يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوا لَا تَرْفَعُٓوا اَصْوَاتَكُمْ فَوْقَ صَوْتِ النَّبِيِّ) - Ey möminlər, Allahın Rəsulu ilə danışanda ədəbinizi qoruyub, səsinizi peyğəmbərin səsindən çox ucaltmayın, ucadan danışmaq ədəbsizlik və hörmətsizliyə işarədir.**

**(وَلَا تَجْهَرُوا لَهُ بِالْقَوْلِ كَجَهْرِ بَعْضِكُمْ لِبَعْضٍ اَنْ تَحْبَطَ اَعْمَالُكُمْ وَاَنْتُمْ لَا تَشْعُرُونَ) - Və öz aranızda çığıraraq danışdığınız kimi peyğəmbərlə danışmayın. Əksinə təzim və hörmət edib, yavaşca danışın. Əgər ucadan danışsanız, özünüz də bilmədən hər bir xeyir əməliniz batil olub, əzaba haqq qazanarsınız.** *(Peyğəmbərin səhabələrindən Sabit ibn Qeys ibn Şəms uca səsli bir kişi idi. Qulağında bir qədər ağırlıq var idi. Elə ki, bu ayə nazil oldu, peyğəmbərin məclisindən çəkilib, daha o məclislərə ayaq basmadı. Peyğəmbər onu soruşub, hadisəni ona nəql etdilər. Buyurdu ki, Sabiti gətirin. Onu çağırıb, məclisdə iştirak etməməsinin səbəbini ondan soruşdu. Sabit dedi: "Ey peyğəmbər, sənə bu ayə nazil olubdur, mən uca səsli bir kişiyəm, qulağımda da ağırlıq var. Yavaş danışa bilmirəm, qorxuram, sənin hüzurunda ucadan danışam, əməlim batil olar. Peyğəmbər buyurdu: "Sən onlardan deyilsən. (Ayə qəsdən ucadan danışanlar haqqındadır). Sən xeyir içində yaşayıb, xeyir içində də vəfat edib, cənnət əhlindən olacaqsan. Peyğəmbərin hüzuruna ətraf qəbilələrdən gələn olanda Əbu Bəkir onlara peyğəmbərlə necə danışmağın və rəftar etmənin yolunu öyrədib, ondan sonra onları peyğəmbərin hüzuruna aparırdı).*

**3) (اِنَّ الَّذٖينَ يَغُضُّونَ اَصْوَاتَهُمْ عِنْدَ رَسُولِ اللّٰهِ) - Həqiqətən, o şəxslər ki, peyğəmbərin məclisində onunla danışan zamanda səslərini yavaş çıxarıb, ucadan danışmayıb, ədəbə riayət edirlər, (اُو۬لٰٓئِكَ الَّذٖينَ امْتَحَنَ اللّٰهُ قُلُوبَهُمْ لِلتَّقْوٰى ۜ لَهُمْ مَغْفِرَةٌ وَاَجْرٌ عَظٖيمٌ) - Allah-Təala belə şəxslərin qəlblərini təqvanın məşəqqətlərinə səbir etməkdə imtahan edib, onları qüvvətli və səbir edən görübdür və bu səbəbdən onlardan ötrü Allah-Təalanın yanında bağışlanmaq, böyük əcr və savab vardır.** (Bədəvilər peyğəmbərin hüzuruna gələndə onun evinin və hücrələrinin ətrafında durub səslənirdilər: "Ey Məhəmməd, evindən çıx, səninlə görüşək, onları ədəbləndirmək və həm də peyğəmbərə təsəlli verməkdən ötrü növbəti ayə nazil oldu).

اِنَّ الَّذِينَ يُنَادُونَكَ مِنْ وَرَآءِ الْحُجُرَاتِ اَكْثَرُهُمْ لَا يَعْقِلُونَ ﴿٤﴾ وَلَوْ اَنَّهُمْ صَبَرُوا حَتّٰى تَخْرُجَ اِلَيْهِمْ
لَكَانَ خَيْرًا لَهُمْ ۚ وَاللّٰهُ غَفُورٌ رَحِيمٌ ﴿٥﴾ يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا اِنْ جَآءَكُمْ فَاسِقٌ بِنَبَإٍ فَتَبَيَّنُوٓا اَنْ تُصِيبُوا
قَوْمًا بِجَهَالَةٍ فَتُصْبِحُوا عَلٰى مَا فَعَلْتُمْ نَادِمِينَ ﴿٦﴾

---

**4) (اِنَّ الَّذِينَ يُنَادُونَكَ مِنْ وَرَآءِ الْحُجُرَاتِ اَكْثَرُهُمْ لَا يَعْقِلُونَ)** - (Ey Məhəmməd), **həqiqətən, o şəxslər ki, ədəbə riayət etməyib, yaşadığın hücrənin kənarından uca səslə səni çağırırlar, onlardan incimə. Onların əksəriyyəti ağılla hərəkət etməyib, belə işin qəbahətini dərk etmirlər. Bəziləri ağıllı olsa da, əksəriyyət** (cahillər) **onlara üstün gəlir.**

**5) (وَلَوْ اَنَّهُمْ صَبَرُوا حَتّٰى تَخْرُجَ اِلَيْهِمْ لَكَانَ خَيْرًا لَهُمْ ۚ وَاللّٰهُ غَفُورٌ رَحِيمٌ)** - (Ey Məhəmməd), **əgər onlar ədəbə riayət edib səni çağırmayıb, sən özün onların yanına çıxıncaya qədər səbir etsələr, əlbəttə onlardan ötrü daha yaxşıdır. Allah-Təalanın peyğəmbərinə qarşı ədəbli olub, tövbə edib bir də belə çirkin əmələ bulaşmasalar, Allah-Təala onlara rəhm edib bağışlayandır.** (Allahın Rəsulu* Vəlid ibn Uqbəni Bəni-Müstəliq camaatından zəkat alması üçün göndərdi. Həmin camaatla Vəlid arasında islamdan əvvəldən qalan bir ədavət var idi).

**(*Qeyd:** *Vəlid Osmanın anabir qardaşı olub, Osman öz xəlifəliyi zamanında onu Kufəyə hakim göndərdi. Şərab içib, sərxoş halda gedib məsciddə camaatla sübh namazını 4 rükət qıldı. Ondan sonra üzünü xalqa tutub dedi: "İstəyirsiniz, sizdən ötrü namazı daha da artırım. Bu gün mənim şad günümdür." Osmanın qətl edilməsinin səbəblərindən biri də onun belə şəxsləri xalqa hakim təyin etməsi idi).*

*Elə ki, gedib onların diyarına yetişdi, onu qarşılamağa çıxdılar. Vəlid oradan qayıdıb, tez peyğəmbərin hüzuruna çıxıb ərz etdi: "Ey peyğəmbər, Bəni-Müstəliq camaatı mürtəd olub, zəkatı verməyib, mənimlə savaşmaq istədilər. Peyğəmbər bu xəbərdən son dərəcə üzüldü. Bəni-Müstəliq camaatı Vəlidin məkr və ədavətindən agah olub, peyğəmbərin hüzuruna getdilər. Peyğəmbər onlara buyurdu: "Belə xilaf əməlləri tərk edin, ya da ki, özüm kimi bir kişini sizə göndərərəm. Sizinlə cihad edib, zəlil olarsınız. Ondan sonra Allahın Rəsulu əlini Əli ibn Əbu Talibin çiyninə vurub dedi: "O şəxs budur. Bəni Müstəliq camaatı dedi: "Peyğəmbərin qəzəbindən Allah-Təalaya pənah aparırıq. Bizdən belə iş olmayıb. İslamdan çıxıb, mürtəd olmamışıq. O vaxt növbəti ayə nazil olub, Vəlidi fasiq adlandırdı).*

**6) (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا اِنْ جَآءَكُمْ فَاسِقٌ بِنَبَإٍ فَتَبَيَّنُوٓا اَنْ تُصِيبُوا قَوْمًا بِجَهَالَةٍ فَتُصْبِحُوا عَلٰى مَا فَعَلْتُمْ نَادِمِينَ) - Ey möminlər, o zaman ki, bir fasiq şəxs gəlib sizə bir xəbər gətirdi,** (necə ki, Vəlid gəlib Bəni-Müstəliq camaatının mürtəd olma xəbərini sizə yetirdi), **təkcə ondan eşitməklə*, qəbul etməyin, əksinə durub, o xəbərin doğruluğunu və həqiqətini araşdırın ki, o işin doğruluğu sizə aydın olsun. Ondan sonra qəbul edin. Əgər işin həqiqətinə agah olmayıb qəbul etsəniz,**

وَاعْلَمُوٓا اَنَّ فِيكُمْ رَسُولَ اللّٰهِ ۜ لَوْ يُطِيعُكُمْ فِي كَثِيرٍ مِنَ الْاَمْرِ لَعَنِتُّمْ وَلٰكِنَّ اللّٰهَ حَبَّبَ اِلَيْكُمُ الْاِيمَانَ
وَزَيَّنَهُ فِي قُلُوبِكُمْ وَكَرَّهَ اِلَيْكُمُ الْكُفْرَ وَالْفُسُوقَ وَالْعِصْيَانَ ۜ اُولٰٓئِكَ هُمُ الرَّاشِدُونَ ۙ﴿٧﴾

---

**ola bilər ki, bilmədən bir camaata əziyyət edərsiz, lakin işin həqiqətini kəşf edəndən sonra etdiyiniz əmələ peşman olsanız, daha o peşmançılıq sizə bir fayda verməz.**

**(*Qeyd:** *"Həqiqətən də, bu ayə biz müsəlmanlardan ötrü doğru ilə yalanı ayırıb, doğruya tabe olmaqda nə böyük və nə gözəl öyüd-nəsihətdir. Biz nəsihət qəbul edən olsaq, bu ayə bizə kifayət edər. Amma eşidən qulaq və görən göz, anlayan qəlb bizdə hardandır? Əksinə, hər bir yalan sözü, Qurana və peyğəmbərin yoluna zidd olan xəbərləri özümüzə qanun və şəriət edib, yalançıları özümüzə rəhbər adlandırıb, özümüzü dəhşətli bir fəlakətə düçar etmişik. Haqdan ar etməyib, "onlar tənə edənin tənəsinə baxmazlar" ayəsinin məzmununa tabe olublar, pak qardaşlarıma ərz edirəm. Bizim aramızda istifadə olunan ehkamlara diqqətlə baxılsa, hər halda onların əksəriyyətinin Allah-Təalanın və peyğəmbərin sözünə xilaf olduğu aydın olacaqdır. Minbərlərdə yüksək səslə bağıran özündən razı şəxslər, xüsusən əhli-beytə, şəhidlərin əfəndisi Hüseyn ibn Əliyə iftira və böhtan atanlar doğrunu tərk edib, yalan sözləri ilə bu camaatı elə zəlalətə salıblar ki, onların xilas olması nəinki çətin, hətta imkansız hala gəlibdir. Yalançılar xalqı məhşər vaxtı haqq-hesabsız əfv edilib, behiştə daxil olub, müxtəlif nemətlərə sahib olub, xüsusən 70 min iri gözlü huri ilə oynayıb, həzz almağa elə inandırıb, elə aldadıb, məğrur ediblər ki, Allah-Təalanın və peyğəmbərin uca fərmanları onlara təsir etməyib, haqdan qaçırlar. Bu məqamda hədsiz dərəcədə üzülüb, qələmim də hərəkətsiz qaldı. Necə ki, bəsirət sahiblərinə gizli deyil).*

**7-8) (وَاعْلَمُوٓا اَنَّ فِيكُمْ رَسُولَ اللّٰهِ ۜ لَوْ يُطِيعُكُمْ فِي كَثِيرٍ مِنَ الْاَمْرِ لَعَنِتُّمْ) - Ey möminlər, gərək bir mətləbə agah olub diqqət edəsiniz. O mətləb budur ki, həqiqətən, Allahın Rəsulu sizin aranızda olduğu halda elə bir haldasınız ki, gərək o halı dəyişdirib, onun ziddini edəsiniz. O hal budur: "Hər bir işdə sizin niyyətiniz odur ki, peyğəmbər sizin rəyinizə tabe olub, əməl etsin. Əgər siz istəyən kimi peyğəmbər hər bir işdə sizin rəyinizə tabe olub, əməl etsə, hər halda siz məşəqqət və fəlakətə düçar olarsınız. Çünki sizin rəyinizdə xəta var. (وَلٰكِنَّ اللّٰهَ حَبَّبَ اِلَيْكُمُ الْاِيمَانَ وَزَيَّنَهُ فِي قُلُوبِكُمْ) - Lakin Allah-Təala sizlərə öz ixtiyarınız ilə imanı sevdirib, qəlbinizdə zinətləndiribdir.**

**(وَكَرَّهَ اِلَيْكُمُ الْكُفْرَ وَالْفُسُوقَ وَالْعِصْيَانَ) - Və kafir olub fasiq və asi olmağı** (öz ixtiyarınız ilə) **Allah-Təala sizə pis göstərib, peyğəmbərin rəyinə tabe olursunuz. (اُولٰٓئِكَ هُمُ الرَّاشِدُونَ)** - (Ey Məhəmməd), **haqq yolunda düz və möhkəm duranlar bu yad olunanlardır, yoxsa öz rəylərinə tabe olmaq**

فَضْلًا مِنَ اللّٰهِ وَنِعْمَةً ۚ وَاللّٰهُ عَلٖيمٌ حَكٖيمٌ ﴿٨﴾ وَاِنْ طَٓائِفَتَانِ مِنَ الْمُؤْمِنٖينَ اقْتَتَلُوا فَاَصْلِحُوا بَيْنَهُمَا ۚ
فَاِنْ بَغَتْ اِحْدٰيهُمَا عَلَى الْاُخْرٰى فَقَاتِلُوا الَّتٖي تَبْغٖي حَتّٰى تَفٖيٓءَ اِلٰٓى اَمْرِ اللّٰهِ ۚ

---

**istəyənlər? (فَضْلًا مِنَ اللّٰهِ وَنِعْمَةً ۚ وَاللّٰهُ عَلٖيمٌ حَكٖيمٌ) - Möminlərə imanı sevimli və küfrü pis göstərmək Allah-Təaladan onlara bir lütf və nemətdir. Allah-Təala möminlərin əhvalından agah olub, mərhəmət edib, nemət verməkdə hikmət sahibidir. Gərək möminlər öz rəylərini tərk edib** (ey Məhəmməd), **sənin rəyinə tabe olsunlar.**

**9) (وَاِنْ طَٓائِفَتَانِ مِنَ الْمُؤْمِنٖينَ اقْتَتَلُوا فَاَصْلِحُوا بَيْنَهُمَا ۚ)* - Əgər möminlərdən iki qrup bir-birilə savaşsalar, siz möminlər onların arasını düzəldin ki, savaşı tərk etsinlər.** (Bu, sizə vacibdir).

**(*Qeyd:** *"Bu hökm möminlərdən ötrü ümumi hökmdür. Dəyişməzdir. Əgər müsəlmanlar bu hökmə əməl etsələr, onların arasında təkəbbür və qürur, nifaq, ədavət kimi xəbislik ağacının heç bir budağı, əlaməti qalmaz. Əvvəlcə sülhlə aranı düzəltmək lazımdır, lakin sülh mümkün olmayanda ikinci yol gücdən istifadə etməkdir, ta ki, ümmətin arasında savaş olmasın. Bəzi məqamlarda savaş sülhlə, bəzən də güc ilə dəf edilir. Əli (ə.s) Cəməl savaşında möminlərin anası Aişənin qoşununa qalib gəldi, qoşunun iki sərkərdəsi – Təlhə və Zübeyr öldürülüb, qoşunu məğlub edəndən sonra o cənabın əsgərləri dedilər: "Bunlarla biz cihad etmişik, gərək özlərini qulam, kəniz edib, mallarını qənimət edək. O cənab buyurdu: "Bunlar müsəlmandırlar, müsəlmanları qulam və kəniz edib, mallarını qənimət etmək caiz deyildir. Dedilər: "Bəs niyə onlarla dava etdik? Buyurdu: "Bu ayənin hökmü ilə onlarla savaşdım. Əvvəlcə onları sülhə dəvət etdim, sülhə tabe olmadılar. Məcbur qalıb, savaşdım. İndi ki, sülhə razı olublar, daha onlarla müşrik kimi rəftar etmək caiz deyildir. Camaat qəbul etməyib dedi: "Onlarla gərək müşriklər kimi rəftar edib, mallarını qarət, özlərini əsir edək. O cənab gördü ki, sakit olmurlar. Buyurdu: "Əsirlərdən biri möminlərin anası Aişədir. Onu özünə kəniz edən kimdir? Dedilər: "Peyğəmbərin xanımını məgər kəniz etmək olar? Buyurdu: "O da bu əsirlərdəndir. Əgər ondan başqasını əsir edib kəniz etmək caiz olsa, ondan ötrü də caiz olar. İndi ki, onun haqqında caiz olmadı, digərlərinin də haqqında caiz olmaz. Hamısı sakit olub, sözlərini geri götürdülər. Cənab Əlinin düşmənləri ilə bu rəftarına baxıb, bilmək olar ki, o böyük şəxsiyyətin hər bir əməli ancaq Allah-Təalanın razılığı üçün idi).*

**(فَاِنْ بَغَتْ اِحْدٰيهُمَا عَلَى الْاُخْرٰى فَقَاتِلُوا الَّتٖي تَبْغٖي حَتّٰى تَفٖيٓءَ اِلٰٓى اَمْرِ اللّٰهِ) - Əgər o iki qrupdan biri sülhü qəbul etməyib, digərinə zülm etsə, siz möminlər onlar Allah-Təalanın əmrinə dönüb, sülhə razı oluncaya qədər onlarla savaşın.**

فَاِنْ فَآءَتْ فَاَصْلِحُوا بَيْنَهُمَا بِالْعَدْلِ وَاَقْسِطُواۜ اِنَّ اللّٰهَ يُحِبُّ الْمُقْسِطِينَ﴿٩﴾ اِنَّمَا الْمُؤْمِنُونَ اِخْوَةٌ
فَاَصْلِحُوا بَيْنَ اَخَوَيْكُمْ وَاتَّقُوا اللّٰهَ لَعَلَّكُمْ تُرْحَمُونَ۟ ﴿١٠﴾ يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا لَا يَسْخَرْ قَوْمٌ مِنْ
قَوْمٍ عَسٰٓى اَنْ يَكُونُوا خَيْرًا مِنْهُمْ وَلَا نِسَٓاءٌ مِنْ نِسَٓاءٍ عَسٰٓى اَنْ يَكُنَّ خَيْرًا مِنْهُنَّۚ وَلَا تَلْمِزُوٓا اَنْفُسَكُمْ
وَلَا تَنَابَزُوا بِالْاَلْقَابِۜ بِئْسَ الِاسْمُ الْفُسُوقُ بَعْدَ الْاِيمَانِۚ

---

**(فَاِنْ فَآءَتْ فَاَصْلِحُوا بَيْنَهُمَا بِالْعَدْلِ) - Əgər zalım qrup sülhə razı olub geri dönsə, o vaxt da ədalət üzrə onların arasında sülhü təmin edin.**

**(وَاَقْسِطُواۜ اِنَّ اللّٰهَ يُحِبُّ الْمُقْسِطِينَ) - Hər bir işdə ədalət ilə hərəkət edin. Həqiqətən, Allah-Təala ədalətlə hərəkət edənləri sevər.**

**10) (اِنَّمَا الْمُؤْمِنُونَ اِخْوَةٌ فَاَصْلِحُوا بَيْنَ اَخَوَيْكُمْ وَاتَّقُوا اللّٰهَ لَعَلَّكُمْ تُرْحَمُونَ)** - (Ey Məhəmməd), **həqiqətən, islama görə möminlər bir-biriləri ilə qardaşdırlar. İki qardaşın arasında savaş zühur edən zamanda digərlərinə vacibdir ki, onların arasını düzəldib, savaşı onlardan dəf etsin. Siz müsəlmanlar bir-birinizlə qardaş olduğunuz üçün savaş zamanı bir-birinizin arasını islah etmək sizə vacibdir. Qardaşlarınızın arasını düzəldin. Allah-Təaladan qorxub, islah etməkdən imtina etməyin. İslah səbəbinə Allah-Təalanın rəhmətinin sizə yetişəcəyinə ümidvar olun. (Allahın Rəsulu (ə.s) buyurdu: "Müsəlman müsəlmanın qardaşıdır. Gərək qardaşına zülm etməyib, onu zəlil etməyib, eyiblərini axtarmasın. Ev, imarət tikəndə binasını o qədər ucaltmasın ki, müsəlman qardaşına gələn külək və havaya onun icazəsi olmadan mane olsun". (Allah-Təala növbəti ayədə boş və batil sözlər danışıb, bir-birinə istehza etməyi və çirkin ləqəblərlə bir-birini yad etməyi qadağan edir).**

**11) (يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا لَا يَسْخَرْ قَوْمٌ مِنْ قَوْمٍ عَسٰٓى اَنْ يَكُونُوا خَيْرًا مِنْهُمْ ) -Ey iman edənlər, heç bir kişi qrupu digər bir kişi qrupuna məsxərə və istehza etməsin. Ola bilər ki, onlar istehza edənlərdən yaxşı şəxslər olsunlar. Siz onlara agah deyilsiniz. Allah-Təala elm sahibidir. (وَلَا نِسَٓاءٌ مِنْ نِسَٓاءٍ عَسٰٓى اَنْ يَكُنَّ خَيْرًا مِنْهُنَّ) -Və heç bir qadın qrupu da başqa bir qadın qrupuna məsxərə və istehza etməsin. Ola bilər ki, onlar istehza edənlərdən yaxşı olsunlar.**

**(وَلَا تَلْمِزُوٓا اَنْفُسَكُمْ) - Nəfsiniz kimi olan möminlərə tənə edib, eyib tutmayın. (وَلَا تَنَابَزُوا بِالْاَلْقَابِ) - Çirkin ləqəblərlə bir-birinizi çağırmayın.** (Amma yaxşı və gözəl ləqəblərlə çağırmaq bəyənilmişdir. Peyğəmbər səhabələrin əksəriyyətini gözəl ləqəblərlə yad edərdi. Məsələn, Əli cənablarına "canım", Həmzəyə Əsədullah (Allahın aslanı), Əbu Bəkrə Siddiq (sadiq), Ömərə Faruq (əyrini düzdən ayıran), Xalid ibn Vəlidə Seyfullah (Allahın qılıncı) deyirdi). **(بِئْسَ الِاسْمُ الْفُسُوقُ بَعْدَ الْاِيمَانِ) - İman edəndən sonra belə çirkin əməllər səbəbi ilə fasiq olub bu adı qazanmaq nə yaman çirkin şeydir.** (Yəni bir-

وَمَنْ لَمْ يَتُبْ فَاُولٰٓئِكَ هُمُ الظَّالِمُونَ﴿١١﴾ يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا اجْتَنِبُوا كَثِيرًا مِنَ الظَّنِّۘ اِنَّ بَعْضَ
الظَّنِّ اِثْمٌ وَلَا تَجَسَّسُوا وَلَا يَغْتَبْ بَعْضُكُمْ بَعْضًاۜ اَيُحِبُّ اَحَدُكُمْ اَنْ يَاْكُلَ لَحْمَ اَخِيهِ مَيْتًا فَكَرِهْتُمُوهُۜ
وَاتَّقُوا اللّٰهَۜ اِنَّ اللّٰهَ تَوَّابٌ رَحِيمٌ ﴿١٢﴾ يَٓا اَيُّهَا النَّاسُ اِنَّا خَلَقْنَاكُمْ مِنْ ذَكَرٍ وَاُنْثٰى وَجَعَلْنَاكُمْ شُعُوبًا
وَقَبَٓائِلَ لِتَعَارَفُواۜ اِنَّ اَكْرَمَكُمْ عِنْدَ اللّٰهِ اَتْقٰيكُمْۜ اِنَّ اللّٰهَ عَلِيمٌ خَبِيرٌ ﴿١٣﴾

---

birinizə məsxərə və istehza edib, çirkin ləqəblərlə yad etməyin, bu, o şəxsin günah etməsinə səbəb olur). (وَمَنْ لَمْ يَتُبْ فَاُولٰٓئِكَ هُمُ الظَّالِمُونَ) **- Kim ki, belə çirkin əməllərdən tövbə etməsə, əlbəttə onlar zalım şəxslərdirlər.**

**12) (يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا اجْتَنِبُوا كَثِيرًا مِنَ الظَّنِّۘ اِنَّ بَعْضَ الظَّنِّ اِثْمٌ) - Ey iman edənlər, insanlar haqqında çox zənn-güman etməkdən çəkinin, həqiqətən, zənnlərin bəzisi (yanlış zənn etmək) günahdır. Ola bilər ki, yaxşı şəxsin haqqında bədgüman edəsiniz, o vaxt da bu, sizdən ötrü günah ola. Bilmək haqqdır, zənn etmək batildir.** (Lakin məşhur fasiq (günahkar) haqqında bədgüman olmaq caizdir). **(وَلَا تَجَسَّسُوا) - Xalqın eyiblərini və məxfi saxladığı əməllərini axtarmayın ki, onlara agah olub eyib tutasınız.** (Allahın Rəsulu bir dəfə xütbə əsnasında səsini ucaldıb buyurdu: “Ey dilləri ilə iman edib, qəlblərinə iman girməyənlər, müsəlmanların gizli eyiblərini axtarmayın, kim ki, müsəlmanların eybini axtarsa, Allah-Təala onun eybini evinin içində də olmuş olsa, zahir edib onu rüsvay edər). **(وَلَا يَغْتَبْ بَعْضُكُمْ بَعْضًا) - Sizlərdən bəziniz digərləri orda olmayan zamanda onun qeybətini eləməyin.** (Xoşlamadığı sözləri onun haqqında deməyin). **(اَيُحِبُّ اَحَدُكُمْ اَنْ يَاْكُلَ لَحْمَ اَخِيهِ مَيْتًا فَكَرِهْتُمُوهُ) - Bəs sizlərdən bir nəfər istəyər ki, qardaşı ölmüş olduğu halda onun ətini yesin? Həqiqətən, siz bunu rədd edib, belə əmələ təşəbbüs etməyin. Möminin qeybətini etmək meyitin ətini yemək kimidir. (وَاتَّقُوا اللّٰهَۜ اِنَّ اللّٰهَ تَوَّابٌ رَحِيمٌ) - Allah-Təaladan qorxub, qeybəti tərk edib tövbə edin. Həqiqətən, Allah-Təala rəhm edib, tövbə edənlərin tövbəsini qəbul edəndir.**

**13) (يَٓا اَيُّهَا النَّاسُ اِنَّا خَلَقْنَاكُمْ مِنْ ذَكَرٍ وَاُنْثٰى وَجَعَلْنَاكُمْ شُعُوبًا وَقَبَٓائِلَ لِتَعَارَفُوا) - Ey insanlar, həqiqətən, sizi bir kişidən** (Adəm), **bir qadından** (Həvva) **yaratdıq. Soy baxımından hamınız bərabərsiniz. Bir-birinizə qarşı üstünlük iddia etmək caiz deyildir. Ondan sonra elə ki, çoxaldınız, sizi xalqlara və qəbilələrə böldük. Ta ki, bir-birinizi tanıyıb, yaxşı əlaqələr qurub, möhtac olduğunuz işlərdə bir-birinizə yardım edib, əskikliklərinizi tamamlayasınız. Soy kökü ilə fəxr edə bilməzsiniz və soyda sizdən ötrü heç bir üstünlük yoxdur. (اِنَّ اَكْرَمَكُمْ عِنْدَ اللّٰهِ اَتْقٰيكُمْ) - Həqiqətən, Allah-Təala yanında* ən hörmətli olanınız müttəqi olanınızdır. (اِنَّ اللّٰهَ عَلِيمٌ خَبِيرٌ) - Həqiqətən, Allah-Təala qəlblərdəki təqvalara agah və xəbərdardır.**

**(*Qeyd:** *“İzzət və hörmət təqva ilə olar. Soyla, ya da dünya malı ilə fəxr etmək ağıllı şəxslərin işi deyil. Ayədən məlum oldu ki, hamı eyni nəsildəndir. Var-dövlət*

قَالَتِ الْاَعْرَابُ اٰمَنَّاۜ قُلْ لَمْ تُؤْمِنُوا وَلٰكِنْ قُولُوٓا اَسْلَمْنَا وَلَمَّا يَدْخُلِ الْاِيمَانُ فٖي قُلُوبِكُمْۜ وَاِنْ تُطٖيعُوا اللّٰهَ وَرَسُولَهُ لَا يَلِتْكُمْ مِنْ اَعْمَالِكُمْ شَيْـًٔاۜ اِنَّ اللّٰهَ غَفُورٌ رَحٖيمٌ ﴿١٤﴾ اِنَّمَا الْمُؤْمِنُونَ الَّذٖينَ اٰمَنُوا بِاللّٰهِ وَرَسُولِهٖ ثُمَّ لَمْ يَرْتَابُوا وَجَاهَدُوا بِاَمْوَالِهِمْ وَاَنْفُسِهِمْ فٖي سَبٖيلِ اللّٰهِۜ اُولٰٓئِكَ هُمُ الصَّادِقُونَ ﴿١٥﴾

---

*də insanlar arasında dövran edib, hər birinin əlində 5 gün qalan şeydir. Çox olub ki, var-dövləti ilə fəxr edən şəxs hər şeyini itirib, kasıblaşıb. Belə şeylə fəxr etmək layiq deyildir. Əsl fəxr olunan şey təqvadır. Elə xəyal olunmasın ki, təqva dünyanı tərk edib, guşənişinlik edib, xalqdan öz döndərib, gecələr namaz qılıb, gündüzlər oruc tutmaqdan ibarətdir. Əksinə, təqva qəlblə olar. Birincisi, Allah-Təalanın əmr və qadağalarına təzim edib hörmət etmək, ikincisi, Allah-Təalanın məxluquna qarşı şəfqətli və mehriban olub insaf və mürüvvətlə hərəkət etmək və üçüncüsü, qəlbi hər bir xəbis xüsusiyyətdən təmizləməkdən ibarətdir. Ey oruc tutub, namaz qılıb, həccə gedənlər, elə şəxslər var ki, qəlbləri xəbis xüsusiyyətlərlə dolu olub, zahirdə insan, batində yırtıcı heyvanatdan da betərdir. Belə şəxslərin sözlərinə və var-dövlətinə aldanmaq, zəlalətə vaqe olmaqdır. Müttəqini fasiqdən ayırıb, həqiqi təqvanı dərk etmək üçün bəsirət və diqqətli baxış lazımdır).*

**14) (قَالَتِ الْاَعْرَابُ اٰمَنَّاۜ قُلْ لَمْ تُؤْمِنُوا وَلٰكِنْ قُولُوٓا اَسْلَمْنَا وَلَمَّا يَدْخُلِ الْاِيمَانُ فٖي قُلُوبِكُمْ)** - (Ey Məhəmməd), **bədəvi ərəblər sənin hüzuruna gəlib, imanlarını izhar edib dedilər: "İman edib yeganə Allah-Təalanı və sənin tövbəni təsdiq etdik.** (Bəni-Əsəd qəbiləsi bir qəhətlik ilində iman etdiklərini bildirib, küfrlərini gizlətdilər ki, onlara yardım edilsin)**.** (Ey Məhəmməd), **onlara de ki, siz iman etməyibsiniz, deməyin ki, iman etmişik, ancaq deyin ki, islama daxil olduq. Lakin hələ sizin qəlbinizə iman daxil olmayıbdır.** (İman etiqad olunan şeyə mütləq şəkildə inanıb təsdiq etməkdən ibarətdir. İslam isə şəhadəti izhar etməklə müsəlmanların arasına daxil olmaq, müsəlmanam deyənin əslində kafir də olsa canı və malının salamat qalması deməkdir. Bəni-Əsəd ərəbləri bu halda idilər). **(وَاِنْ تُطٖيعُوا اللّٰهَ وَرَسُولَهُ لَا يَلِتْكُمْ مِنْ اَعْمَالِكُمْ شَيْـًٔاۜ) - Siz zahirdə islama daxil olub, həqiqətən iman etməyənlər, əgər həqiqətən, Allah-Təalaya və onun peyğəmbərinə** (Məhəmmədə) **itaət etsəniz, əməllərinizin savabından heç bir şey əskilməyib, hamısı sizə çatar. (اِنَّ اللّٰهَ غَفُورٌ رَحٖيمٌ) Həqiqətən, Allah-Təala itaət edib tövbə edənlərə rəhm edib, onları bağışlayandır.**

**15) (اِنَّمَا الْمُؤْمِنُونَ الَّذٖينَ اٰمَنُوا بِاللّٰهِ وَرَسُولِهٖ ثُمَّ لَمْ يَرْتَابُوا وَجَاهَدُوا بِاَمْوَالِهِمْ وَاَنْفُسِهِمْ فٖي سَبٖيلِ اللّٰهِۜ اُولٰٓئِكَ هُمُ الصَّادِقُونَ)** - (Ey Məhəmməd), **həqiqətən, möminlər o şəxslərdir ki, Allah-Təalaya və onun peyğəmbərinə iman edib, ondan sonra şübhə etməyib, mal və canları ilə Allah-Təala yolunda cihad edərlər. İmanlarında sadiq olanlar bunlardır,** (nəinki yalandan iman edən Bəni-Əsəd camaatı). (Elə ki, bu ayə nazil oldu, Bəni-Əsəd camaatı gedib peyğəmbərin hüzurunda and içdilər ki, biz imanımızda sadiqik, o vaxt da bu növbəti ayə nazil oldu).

قُلْ اَتُعَلِّمُونَ اللّٰهَ بِدٖينِكُمْ وَاللّٰهُ يَعْلَمُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۜ وَاللّٰهُ بِكُلِّ شَيْءٍ عَلٖيمٌ ﴿١٦﴾
يَمُنُّونَ عَلَيْكَ اَنْ اَسْلَمُواۜ قُلْ لَا تَمُنُّوا عَلَيَّ اِسْلَامَكُمْۚ بَلِ اللّٰهُ يَمُنُّ عَلَيْكُمْ اَنْ هَدٰيكُمْ لِلْاٖيمَانِ اِنْ
كُنْتُمْ صَادِقٖينَ ﴿١٧﴾ اِنَّ اللّٰهَ يَعْلَمُ غَيْبَ السَّمٰوَاتِ وَالْاَرْضِۜ وَاللّٰهُ بَصٖيرٌ بِمَا تَعْمَلُونَ ﴿١٨﴾

---

**16) (قُلْ اَتُعَلِّمُونَ اللّٰهَ بِدٖينِكُمْ)** - (Ey Məhəmməd), (Bəni-Əsəd camaatına) **de ki, dininizi Allah-Təalaya öyrədirsiniz? Siz cahilsiniz. Allah-Təala bilir ki, sizin dininiz yoxdur. (وَاللّٰهُ يَعْلَمُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۜ وَاللّٰهُ بِكُلِّ شَيْءٍ عَلٖيمٌ) - Necə olur ki, siz Allah-Təalaya öyrədəsiniz? Halbuki Allah-Təala göylərdə və yerdə olan şeylərə agahdır, sizin xəbər verməyinizə ehtiyacı olmayıb hər bir şeyi biləndir.** (Həmin Bəni-Əsəd camaatı iman etdiklərini iddia edib, həm də iman etdiklərinə görə peyğəmbərə minnət qoyub deyirdilər: “Biz iman etmişik. Bu barədə növbəti ayə nazil oldu).

**17) (يَمُنُّونَ عَلَيْكَ اَنْ اَسْلَمُواۜ)** - (Ey Məhəmməd), **bu ərəblər ki, deyirlər: “İman etmişik, hansı ki, ona iman deməyib, islam demək layiqdir, islama daxil olduqları üçün sənə minnət qoyurlar. (قُلْ لَا تَمُنُّوا عَلَيَّ اِسْلَامَكُمْ)** - (Ey Məhəmməd), **onlara de ki, islama daxil olmağınıza görə mənə minnət qoymayın, imana və ya islama daxil olan kəs heç kimə minnət qoya bilməz.**

**(بَلِ اللّٰهُ يَمُنُّ عَلَيْكُمْ اَنْ هَدٰيكُمْ لِلْاٖيمَانِ اِنْ كُنْتُمْ صَادِقٖينَ) - Əgər iman etməkdə sadiqsəniz, daha minnət qoymaq sizdən ötrü layiq deyildir. Əksinə, Allah-Təala sizi imana hidayət etdiyi üçün sizə minnət qoyar, halbuki sizdə iman da yoxdur.**

**18) (اِنَّ اللّٰهَ يَعْلَمُ غَيْبَ السَّمٰوَاتِ وَالْاَرْضِۜ وَاللّٰهُ بَصٖيرٌ بِمَا تَعْمَلُونَ) - Həqiqətən, Allah-Təala göylərin və yerin qeybinə agah olub və sizin hər bir əməllərinizi görəndir. Əgər sizdə iman olsaydı, Allah-Təala bilərdi. Demək siz iman iddiası etməkdə yalançısınız.**

**Allaha həmd olsun, Hucurat surəsinin təfsiri tamamlandı. Ədəb elminə, gözəl əxlaqa və insanların arasını düzəltməyə aid olan ayələri ehtiva edən bir mübarək surədir. Quran ayələrinin təfsirinə baxanda diqqət etmək lazımdır. Heyhat, biz müsəlmanlarda görən göz, eşidən qulaq, dərk edən qəlb yoxdur. Əgər olsaydı, Qurani-Şərifdən faydalanıb, belə rəzil hallara düçar olmazdıq. Qəflət yuxusundan oyanıb ayılmaq vaxtıdır. Hər bir müsəlman ətrafına diqqətlə baxıb, vaxtı qənimət bilməlidir. Allahın Rəsulu buyurdu: “Kim Hucurat surəsini oxusa, Allah-Təala itaət edən və asi olanların sayı qədər ona əcr-savab bəxş edər. Oxumaqdan məqsəd ayələrdə bəhs olunan gözəl xüsusiyyətlərə sahib olub, onları əldə etməkdir.**

## QAF SURƏSİ

50-ci surədir. Məkkədə nazil olub, 46 ayə, 357 kəlmə və 1494 hərfdir.

قٓ ۚ وَالْقُرْاٰنِ الْمَجِيدِ ۚ ﴿١﴾ بَلْ عَجِبُوٓا اَنْ جَٓاءَهُمْ مُنْذِرٌ مِنْهُمْ فَقَالَ الْكَافِرُونَ هٰذَا شَيْءٌ عَجِيبٌ ﴿٢﴾
ءَاِذَا مِتْنَا وَكُنَّا تُرَابًا ۚ ذٰلِكَ رَجْعٌ بَعِيدٌ ﴿٣﴾ قَدْ عَلِمْنَا مَا تَنْقُصُ الْاَرْضُ مِنْهُمْ ۚ وَعِنْدَنَا كِتَابٌ حَفِيظٌ
﴿٤﴾ بَلْ كَذَّبُوا بِالْحَقِّ لَمَّا جَٓاءَهُمْ فَهُمْ فِي اَمْرٍ مَرِيجٍ ﴿٥﴾ اَفَلَمْ يَنْظُرُوٓا اِلَى السَّمَٓاءِ فَوْقَهُمْ كَيْفَ
بَنَيْنَاهَا وَزَيَّنَّاهَا وَمَا لَهَا مِنْ فُرُوجٍ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (قٓ) - Bu mübarək surənin adıdır.**

**(وَالْقُرْاٰنِ الْمَجِيدِ) - And olsun izzət və şərəf sahibi olan bu Qurana ki, həmin bu Quran Allah-Təala tərəfindən möcüzəli bir kəlamdır. Peyğəmbərin doğruluğunu izhar etməkdən ötrü ona möcüzə bəxş edibdir.**

**2) (بَلْ عَجِبُوٓا اَنْ جَٓاءَهُمْ مُنْذِرٌ مِنْهُمْ فَقَالَ الْكَافِرُونَ هٰذَا شَيْءٌ عَجِيبٌ) - Müşriklər Quranı qəbul etməyib, hətta özlərindən onlara qorxudan gəlib, onları qorxutmasından təəccüb ediblər, həmin kafir və müşriklər dedilər:** (Məhəmmədin) **peyğəmbər olması təəccüblü bir şeydir. Biz onu qəbul etmərik.**

**3) (ءَاِذَا مِتْنَا وَكُنَّا تُرَابًا ۚ ذٰلِكَ رَجْعٌ بَعِيدٌ)** - (Ey Məhəmməd), **kafirlər yenidən həyat tapıb, qiyamətdə hazır olmağı da inkar edib dedilər: "Bəs o zaman ki, ölüm bizə gəlib, torpaq olduq, o vaxt yenidən dirilib, qayıdıb məhşərdə hazır olacağıq? Yox, bu, uzaq bir qayıdışdır ki, mümkün olan iş deyil.**

**4) (قَدْ عَلِمْنَا مَا تَنْقُصُ الْاَرْضُ مِنْهُمْ)** - (Ey Məhəmməd), **həqiqətən, biz insanların hər bir əzasını yerin necə çürüdüb, azaltdığına, məhv edəcəyinə agahıq. Belə agah olan onlara yenidən həyat verib, əzalarını tərtib etməyə də agah və qadirdir. (وَعِنْدَنَا كِتَابٌ حَفِيظٌ)** - (Ey Məhəmməd), **dəyişilməkdən qorunan kitab*** (lövhi-məhfuz) **bizim yanımızdadır. İnsanların hər bir əməlləri orada qeyd olunub, dəyişən deyildir.**

**(*Qeyd:** *"Kitab və lövhi-məhfuz Allah-Təalanın elmindən ibarətdir).*

**5) (بَلْ كَذَّبُوا بِالْحَقِّ لَمَّا جَٓاءَهُمْ) - Lakin o zaman ki, onlara peyğəmbər gəldi, müşriklər haqqı** (Məhəmmədi) **təkzib edib qəbul etmədilər. (فَهُمْ فِي اَمْرٍ مَرِيجٍ) - Müşriklər** (Məhəmmədin) **barəsində iztirab** (şübhə) **içindədirlər.** (Müxtəlif adlarla onu adlandırıb gah şair, gah sehrbaz, gah da kahin deyirlər).

**6) (اَفَلَمْ يَنْظُرُوٓا اِلَى السَّمَٓاءِ فَوْقَهُمْ كَيْفَ بَنَيْنَاهَا وَزَيَّنَّاهَا وَمَا لَهَا مِنْ فُرُوجٍ)** - (Ey Məhəmməd),

وَالْاَرْضَ مَدَدْنَاهَا وَاَلْقَيْنَا فِيهَا رَوَاسِيَ وَاَنْبَتْنَا فِيهَا مِنْ كُلِّ زَوْجٍ بَهِيجٍۙ ﴿٧﴾ تَبْصِرَةً وَذِكْرٰى لِكُلِّ
عَبْدٍ مُنِيبٍ ﴿٨﴾ وَنَزَّلْنَا مِنَ السَّمَاۤءِ مَاۤءً مُبَارَكًا فَاَنْبَتْنَا بِهٖ جَنَّاتٍ وَحَبَّ الْحَصِيدِۙ ﴿٩﴾ وَالنَّخْلَ
بَاسِقَاتٍ لَهَا طَلْعٌ نَضِيدٌۙ ﴿١٠﴾ رِزْقًا لِلْعِبَادِۙ وَاَحْيَيْنَا بِهٖ بَلْدَةً مَيْتًاۜ كَذٰلِكَ الْخُرُوجُ ﴿١١﴾ كَذَّبَتْ
قَبْلَهُمْ قَوْمُ نُوحٍ وَاَصْحَابُ الرَّسِّ وَثَمُودُۙ ﴿١٢﴾ وَعَادٌ وَفِرْعَوْنُ وَاِخْوَانُ لُوطٍۙ ﴿١٣﴾ وَاَصْحَابُ
الْاَيْكَةِ وَقَوْمُ تُبَّعٍۜ كُلٌّ كَذَّبَ الرُّسُلَ فَحَقَّ وَعِيدِ ﴿١٤﴾ اَفَعَيِينَا بِالْخَلْقِ الْاَوَّلِۜ بَلْ هُمْ فِي لَبْسٍ مِنْ
خَلْقٍ جَدِيدٍ ﴿١٥﴾

---

**onlar ki, qiyaməti inkar edirlər, bəs bizim qüdrətimizin əsərlərini müşahidə edib,** (yuxarı tərəflərindəki) **göyə baxmırlar ki, onda heç bir xələl və açıq yer olmadığı halda necə biz onu yaradıb, nurani ulduzlarla zinət vermişik? Hər bir tərəfə baxanda qüsursuz görünür.**

**7) (وَالْاَرْضَ مَدَدْنَاهَا وَاَلْقَيْنَا فِيهَا رَوَاسِيَ وَاَنْبَتْنَا فِيهَا مِنْ كُلِّ زَوْجٍ بَهِيجٍۙ) - Və yerə baxmırlar ki, biz onu kamil qüdrətimizlə onların məişətlərindən ötrü çəkib yaydıq və fayda verməkdən ötrü uca və möhkəm dağları yerə saldıq ki, o dağların suyundan və digər şeylərindən mənfəət əldə etsinlər və bu səbəbdən kamil qüdrətimizlə sevinc və şadlıq gətirən hər bir növ bitki və güllərdən yerdə göyərtdik. Bəs bunlar bizim qüdrətimizə işarə etmirmi?**

**8) (تَبْصِرَةً وَذِكْرٰى لِكُلِّ عَبْدٍ مُنِيبٍ) - Allah-Təalanın tərəfinə dönüb, məxluqatı haqqında təfəkkür edin, hər bir bəndənin ayılıb və bəsirət sahibi olmasından ötrü göyləri və yeri yaratdıq.**

**9) (وَنَزَّلْنَا مِنَ السَّمَاۤءِ مَاۤءً مُبَارَكًا فَاَنْبَتْنَا بِهٖ جَنَّاتٍ وَحَبَّ الْحَصِيدِۙ) - Göydən xeyir və bərəkəti çox olan su göndərib, onun səbəbinə yer üzündə bağlar və əkilən dənələr** (buğda, arpa, noxud kimi şeylər) **göyərtdik,**

**10) (وَالنَّخْلَ بَاسِقَاتٍ لَهَا طَلْعٌ نَضِيدٌ) - hansı ki, o suyun səbəbinə bir-birinin üstündə yığılmış tumurcuqları olan uca xurma ağaclarını bitirdik.**

**11) (رِزْقًا لِلْعِبَادِۙ)** - (Ey Məhəmməd), **bu nemətləri bəndələrimizin ruzisindən ötrü yaradıb göyərtdik. (وَاَحْيَيْنَا بِهٖ بَلْدَةً مَيْتًاۜ كَذٰلِكَ الْخُرُوجُ) - O suyun səbəbinə şəhərin və ya kəndin ölü yerlərini dirildib, təzə həyat verdik. Ölü yerləri dirildən kimi siz insanlara da öləndən sonra həyat verib, yerdən çıxaracağıq.**

**12-13-14) ( كَذَّبَتْ قَبْلَهُمْ قَوْمُ نُوحٍ وَاَصْحَابُ الرَّسِّ وَثَمُودُۙ وَعَادٌ وَفِرْعَوْنُ وَاِخْوَانُ لُوطٍۙ وَاَصْحَابُ الْاَيْكَةِ وَقَوْمُ تُبَّعٍۜ كُلٌّ كَذَّبَ الرُّسُلَ فَحَقَّ وَعِيدِ )** (Ey Məhəmməd), **bu Qüreyş camaatından əvvəlki bu** (bəhs olunan) **camaatların hamısı peyğəmbərlərini təkzib etdilər və bu səbəbdən mənim əzabım onlara layiq oldu. Hamısı həlak oldular. Bu Qüreyş camaatı səni təkzib etdiyi üçün qəmgin olma.**

**15) (اَفَعَيِينَا بِالْخَلْقِ الْاَوَّلِۜ بَلْ هُمْ فِي لَبْسٍ مِنْ خَلْقٍ جَدِيدٍ)** - (Ey Məhəmməd), **bəs biz**

وَلَقَدْ خَلَقْنَا الْاِنْسَانَ وَنَعْلَمُ مَا تُوَسْوِسُ بِهٖ نَفْسُهُ ۚ وَنَحْنُ اَقْرَبُ اِلَيْهِ مِنْ حَبْلِ الْوَرٖيدِ﴿١٦﴾ اِذْ يَتَلَقَّى الْمُتَلَقِّيَانِ عَنِ الْيَمٖينِ وَعَنِ الشِّمَالِ قَعٖيدٌ﴿١٧﴾ مَا يَلْفِظُ مِنْ قَوْلٍ اِلَّا لَدَيْهِ رَقٖيبٌ عَتٖيدٌ ﴿١٨﴾ وَجَٓاءَتْ سَكْرَةُ الْمَوْتِ بِالْحَقِّ ۜ ذٰلِكَ مَا كُنْتَ مِنْهُ تَحٖيدُ ﴿١٩﴾ وَنُفِخَ فِي الصُّورِ ۜ ذٰلِكَ يَوْمُ الْوَعٖيدِ﴿٢٠﴾ وَجَٓاءَتْ كُلُّ نَفْسٍ مَعَهَا سَٓائِقٌ وَشَهٖيدٌ﴿٢١﴾

---

**onları əvvəlcə yaratmaqdan aciz olmuşduq ki, yenidən yaratmaqdan aciz olaq? Onlar özləri bizim ilk yaradılışa qadir olduğumuzu inkar etmirlər. Bəlkə yenidən və təzədən yaratmaq onlara şübhəli gəlir, şeytan vəsvəsə verib ki, yenidən dirilmək adətdən kənar bir işdir və mümkün olan deyildir. Odur ki onlar da inkar edirlər.**

**16) (وَلَقَدْ خَلَقْنَا الْاِنْسَانَ وَنَعْلَمُ مَا تُوَسْوِسُ بِهٖ نَفْسُهُ)** - (Ey Məhəmməd), **həqiqətən, biz insanı yaradıb və onun qəlbinə gələn, nəfsinin vəsvəsə etdiyi hər bir şeyə agahıq. (وَنَحْنُ اَقْرَبُ اِلَيْهِ مِنْ حَبْلِ الْوَرٖيدِ)* - Biz insana boynunun şahdamarından daha yaxınıq.**

**(*Qeyd:** *"İnsanın boynunda iki damar var ki, onların arasında hülqum var, bu damarlardan insanın başına qan çıxıb, insanın həyatı onlarla davam edər. Onların birinə "vərid" (boyun damarı), ikisinə bir yerdə "vərideyn" deyilir).*

**17) (اِذْ يَتَلَقَّى الْمُتَلَقِّيَانِ عَنِ الْيَمٖينِ وَعَنِ الشِّمَالِ قَعٖيدٌ) - Xüsusən, o zamanda ki, insanın əməllərini mühafizə edən iki* mələk - biri sağda və biri solda əyləşib, onun əməllərini mühafizə edirlər. Biz ona boynunun şahdamarından da daha yaxınıq.**

**(*Qeyd:** *"Allahın Rəsulu buyurdu: "İnsana müvəkkil olan iki mələyin qələmi sənin dilin və mürəkkəbi sənin ağzının suyudur. Allahın Rəsulu (ə.s) doğru buyurub***).**

**18) (مَا يَلْفِظُ مِنْ قَوْلٍ اِلَّا لَدَيْهِ رَقٖيبٌ عَتٖيدٌ) - İnsan heç bir söz deməz ki, onun yanında hazır olub sözlərini mühafizə edən olmasın.**

**19) (وَجَٓاءَتْ سَكْرَةُ الْمَوْتِ بِالْحَقِّ ۜ ذٰلِكَ مَا كُنْتَ مِنْهُ تَحٖيدُ) - Ey insan, ölümdən qafil idin. Budur, ölümün şiddəti necə ki, vəd edilmişdi, vaqe olub gəldi. Bu, həmin əmrdir ki, eşidəndə ondan çəkinib, qaçırdın. Lakin qaça bilməyib gəlib səni tutdu.**

**20) (وَنُفِخَ فِي الصُّورِ ۜ ذٰلِكَ يَوْمُ الْوَعٖيدِ) - O zaman ki, surətlərə üfürülüb, insan dirilib, ayağa durub məhşərdə hazır olar,** (Ey Məhəmməd), **o vaxt onlara deyilər: bu gün dünyada sizə vəd edilən həmin gündür ki, bu günü inkar edirdiniz.**

**21) (وَجَٓاءَتْ كُلُّ نَفْسٍ مَعَهَا سَٓائِقٌ وَشَهٖيدٌ) - Qiyamət günündə hər bir nəfs məhşərə gələr. Onunla birlikdə onu sürüb məhşərə gətirən, bir də əgər əməllərini inkar etsə, bu çirkin əməllərinə şəhadət verən olar.**

لَقَدْ كُنْتَ فِي غَفْلَةٍ مِنْ هٰذَا فَكَشَفْنَا عَنْكَ غِطَاءَكَ فَبَصَرُكَ الْيَوْمَ حَدِيدٌ ﴿٢٢﴾ وَقَالَ قَرِينُهُ هٰذَا مَا لَدَيَّ عَتِيدٌ ﴿٢٣﴾ اَلْقِيَا فِي جَهَنَّمَ كُلَّ كَفَّارٍ عَنِيدٍ ﴿٢٤﴾ مَنَّاعٍ لِلْخَيْرِ مُعْتَدٍ مُرِيبٍ ﴿٢٥﴾ اَلَّذِي جَعَلَ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ فَاَلْقِيَاهُ فِي الْعَذَابِ الشَّدِيدِ ﴿٢٦﴾ قَالَ قَرِينُهُ رَبَّنَا مَٓا اَطْغَيْتُهُ وَلٰكِنْ كَانَ فِي ضَلَالٍ بَعِيدٍ ﴿٢٧﴾

---

**22) (لَقَدْ كُنْتَ فِي غَفْلَةٍ مِنْ هٰذَا فَكَشَفْنَا عَنْكَ غِطَاءَكَ فَبَصَرُكَ الْيَوْمَ حَدِيدٌ) - Qiyamət günündə qiyaməti inkar edən şəxsə deyilər: "Həqiqətən, bu günkü gündən və əzabla qarşılamaqdan qafil idin. İndi o qəfləti və pərdəni səndən götürüb, yuxudan oyanan kimi ayılıb gözün bu günkü gündə hər bir şeyi tez və sərrast dərk edir. Bəs indi də inkar edə bilərsənmi?**

**23) (وَقَالَ قَرِينُهُ هٰذَا مَا لَدَيَّ عَتِيدٌ) - Asi şəxsin yoldaşı, onu bəlalara salan şeytan** (şəri əmr edən xəbis nəfs) **deyir: "Budur, mənim yanımda hazır olub və mənim idarəm altında olan o adam ki, onu cəhənnəmdən ötrü hazır etmişəm, bu, o kişidir. Əzaba layiqdir. Aparıb əzab edin.**

**24) (اَلْقِيَا فِي جَهَنَّمَ كُلَّ كَفَّارٍ عَنِيدٍ) - O vaxt da Allah-Təala tərəfindən qiyaməti inkar edən şəxsi sürüb məhşərə gətirən və əməllərinə şəhadət verən iki mələklərə xitab olunub deyilər: "Haqqı inkar etmədə inad edən hər bir kafiri tutub cəhənnəmə salın.**

**25) (مَنَّاعٍ لِلْخَيْرِ مُعْتَدٍ مُرِيبٍ) - Haqqı inkar etməkdə inad edən kafir o şəxsdir ki, əhlinə və layiq olana xeyir verməyə mane* olmaqdan əlavə zülmü özünə şüar seçib, Allah-Təalaya və haqq dinə də şəkk edər.**

(***Qeyd:** *Xeyrə mane olmaq iki cür olur: "Birincisi - şəxs özü öz malını hər bir xeyir əməldə, millətin ehtiyacı yolunda sərf etməyə mane olub, varislərindən ötrü yığar. İkincisi - başqa sərf edənlərə də mane olub, ya da ki, onlara məsxərə və istehza edər. Bu xəbis sifətlərin hər ikisi bizim əksər varlılarda mövcuddur. Özlərinə Quran əhli deyib, Quran oxuyub, gözlərindən yaş tökürlər, lakin Quranın hökmünə əməl etməyib, bu ayənin əhatə dairəsinə daxil olub, məhşərdə kafirlərlə birlikdə dirilməyə layiq olarlar. Bəs belə şəxslərə müsəlman demək olarmı?)*

**26) (اَلَّذِي جَعَلَ مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ فَاَلْقِيَاهُ فِي الْعَذَابِ الشَّدِيدِ) - Xeyir verməyə mane olan şəxsin sifəti odur ki, Allah-Təala ilə birlikdə özgə məbudlar** (o cümlədən öz nəfsini) **özünə məbud seçib.** (Qiyamət günü həmin iki mələklərə xitab edib deyərik: "Belə şəxsi cəhənnəmin şiddətli əzabına salın).

**27) (قَالَ قَرِينُهُ رَبَّنَا مَٓا اَطْغَيْتُهُ وَلٰكِنْ كَانَ فِي ضَلَالٍ بَعِيدٍ) - Günahkar şəxs deyər: "Ey mənim rəbbim, şeytan (şəri əmr edən xəbis nəfs) məni asi edib zəlalətə saldı".** (Şeytan deyər: "Ey mənim rəbbim, o, yalan deyir. Mən onu asi edib zəlalətə salmadım. Lakin özü haqdan uzaq, zəlalətdə olan xəbis bir şəxs idi. Özünün zəlalətini mənə isnad verməsi doğru deyil).

قَالَ لَا تَخْتَصِمُوا لَدَيَّ وَقَدْ قَدَّمْتُ اِلَيْكُمْ بِالْوَعِيدِ ﴿٢٨﴾ مَا يُبَدَّلُ الْقَوْلُ لَدَيَّ وَمَٓا اَنَا۬ بِظَلَّامٍ لِلْعَبِيدِ
﴿٢٩﴾ يَوْمَ نَقُولُ لِجَهَنَّمَ هَلِ امْتَلَاْتِ وَتَقُولُ هَلْ مِنْ مَزِيدٍ ﴿٣٠﴾ وَاُزْلِفَتِ الْجَنَّةُ لِلْمُتَّقِينَ غَيْرَ
بَعِيدٍ﴿٣١﴾ هٰذَا مَا تُوعَدُونَ لِكُلِّ اَوَّابٍ حَفِيظٍ﴿٣٢﴾ مَنْ خَشِيَ الرَّحْمٰنَ بِالْغَيْبِ وَجَٓاءَ بِقَلْبٍ
مُنِيبٍ ﴿٣٣﴾ اُدْخُلُوهَا بِسَلَامٍ ذٰلِكَ يَوْمُ الْخُلُودِ ﴿٣٤﴾لَهُمْ مَا يَشَٓاؤُ۫نَ فِيهَا وَلَدَيْنَا مَزِيدٌ ﴿٣٥﴾

---

**28) (قَالَ لَا تَخْتَصِمُوا لَدَيَّ وَقَدْ قَدَّمْتُ اِلَيْكُمْ بِالْوَعِيدِ) - O vaxt da Allah-Təala buyurar: “Haqq-hesab məqamında mənim hüzurumda bir-birinizlə mübahisə etməyin. Mübahisə etmək sizə fayda verməz. Dünyada sizə kitab və peyğəmbərlər göndərib, peyğəmbərlər vasitəsi ilə bu günkü günün əzabını sizə bildirmişəm. Daha sizdən ötrü üzr imkanı qalmayıbdır.**

**29) (مَا يُبَدَّلُ الْقَوْلُ لَدَيَّ وَمَٓا اَنَا۬ بِظَلَّامٍ لِلْعَبِيدِ) - Arzunuz olmasın ki, sizə verdiyim əzab vədini dəyişdirib, sizi əfv edəcəm. Necə ki, əzab vədi vermişəm, əzab edəcəyəm və əzab etməkdə əzaba layiq olmayan bəndələrimə zülm edən deyiləm. Bu zalımların xüsusiyyətidir. Mən aləmlərin rəbbiyəm, zülm sifətindən uzağam.**

**30) (يَوْمَ نَقُولُ لِجَهَنَّمَ هَلِ امْتَلَاْتِ وَتَقُولُ هَلْ مِنْ مَزِيدٍ) -** (Ey Məhəmməd,) **qiyamət günündə elə ki, asiləri cəhənnəmə daxil etdik, o vaxt cəhənnəmə xitab edib deyərik: “Ey cəhənnəm, doldun, ya da yenə səndə daxil olmağa yer var? Cəhənnəm cavab verib deyər: “Mən dolan deyiləm, əgər artıq vardırsa, verin gəlsin. Hələ məndə boş yer çoxdur.**

**31) (وَاُزْلِفَتِ الْجَنَّةُ لِلْمُتَّقِينَ غَيْرَ بَعِيد) - Cənnət müttəqilərdən ötrü uzaq olmayıb, elə yaxın olar ki, asan yolla cənnətə daxil olarlar.**

**32) (هٰذَا مَا تُوعَدُونَ لِكُلِّ اَوَّابٍ حَفِيظٍ) - Cənnət hər bir müttəqi və tövbə edib, Allah-Təala tərəfinə qayıdıb, dinini mühafizə edənlərə yaxın olar və onlara deyilər: “Bu, o əcr və savabdır ki, dünyada sizə vəd edilirdi. İndi budur, ona rastladınız.**

**33) (مَنْ خَشِيَ الرَّحْمٰنَ بِالْغَيْبِ وَجَٓاءَ بِقَلْبٍ مُنِيبٍ) -Tövbə edənlər o şəxslərdirlər ki, onu görmədiyi halda Rəhman olan Allah-Təaladan qorxub, Allah-Təalaya yönələn qəlblə ona gələrlər.**

**34) (اُدْخُلُوهَا بِسَلَامٍ ذٰلِكَ يَوْمُ الْخُلُودِ) -** (Ey Məhəmməd), **bizim tərəfimizdən möminlərə deyilər: “Əzabdan və nemətlərin məhv olmasından salamat olduğunuz halda cənnətə daxil olun. Sizin üçün cənnətdə həmişəlik təqdir edilən gün bu günkü gündür.**

**35) (لَهُمْ مَا يَشَٓاؤُ۫نَ فِيهَا وَلَدَيْنَا مَزِيدٌ) -** (Ey Məhəmməd), **onlardan ötrü cənnətdə istədikləri hər bir nemət mövcuddur və o nemətlərdən əlavə onların xəyalına gəlməyən nemətlər də onlardan ötrü bizim yanımızda hazırdır.**

وَكَمْ اَهْلَكْنَا قَبْلَهُمْ مِنْ قَرْنٍ هُمْ اَشَدُّ مِنْهُمْ بَطْشًا فَنَقَّبُوا فِي الْبِلَادِۜ هَلْ مِنْ مَحِيصٍ ﴿٣٦﴾ اِنَّ فِي
ذٰلِكَ لَذِكْرٰى لِمَنْ كَانَ لَهُ قَلْبٌ اَوْ اَلْقَى السَّمْعَ وَهُوَ شَهِيدٌ ﴿٣٧﴾ وَلَقَدْ خَلَقْنَا السَّمٰوَاتِ وَالْاَرْضَ
وَمَا بَيْنَهُمَا فِي سِتَّةِ اَيَّامٍۗ وَمَا مَسَّنَا مِنْ لُغُوبٍ ﴿٣٨﴾ فَاصْبِرْ عَلٰى مَا يَقُولُونَ وَسَبِّحْ بِحَمْدِ رَبِّكَ قَبْلَ
طُلُوعِ الشَّمْسِ وَقَبْلَ الْغُرُوبِۚ ﴿٣٩﴾ وَمِنَ الَّيْلِ فَسَبِّحْهُ وَاَدْبَارَ السُّجُودِ ﴿٤٠﴾ وَاسْتَمِعْ يَوْمَ يُنَادِ
الْمُنَادِ مِنْ مَكَانٍ قَرِيبٍۙ ﴿٤١﴾ يَوْمَ يَسْمَعُونَ الصَّيْحَةَ بِالْحَقِّۜ ذٰلِكَ يَوْمُ الْخُرُوجِ ﴿٤٢﴾

---

**36) (وَكَمْ اَهْلَكْنَا قَبْلَهُمْ مِنْ قَرْنٍ هُمْ اَشَدُّ مِنْهُمْ بَطْشًا)** - (Ey Məhəmməd), **bu müşriklərdən əvvəl nə qədər ümmətlər həlak etdik. Hansı ki, onlar bu müşriklərdən daha şücaətli və qüvvətli idilər. (فَنَقَّبُوا فِي الْبِلَادِۜ هَلْ مِنْ مَحِيصٍ) Qüvvət və şücaətlərindən hər bir diyara daxil olub, qətl, qarət edib onların gizli işlərini axtarıb, ona agah olurdular. Bununla belə onlardan ötrü bizim əzabımızdan qaçıb qurtulmaq imkanı varmı?**

**37) (اِنَّ فِي ذٰلِكَ لَذِكْرٰى لِمَنْ كَانَ لَهُ قَلْبٌ اَوْ اَلْقَى السَّمْعَ وَهُوَ شَهِيدٌ)** - (Ey Məhəmməd), **həqiqətən, əvvəlki ümmətlərin həlak olmasında o şəxsdən ötrü elə öyüd-nəsihət vardır ki, onun dərk edən qəlbi olub və ya diqqətlə qulaq asıb, açıq zehinlə hazırlaşıb, hər bir şeyi anlayar. Əlbəttə ancaq belə şəxslər nəsihət ala bilərlər.**

**38) (وَلَقَدْ خَلَقْنَا السَّمٰوَاتِ وَالْاَرْضَ وَمَا بَيْنَهُمَا فِي سِتَّةِ اَيَّامٍۗ وَمَا مَسَّنَا مِنْ لُغُوبٍ) -Həqiqətən, göyləri və yeri və onların arasında olan hər bir məxluqu altı gündə yaratdıq. O barədə bizə bir zəhmət və məşəqqqət olmadı və aciz olmadıq. Bəs sizi yenidən yaratmaqda da aciz olmarıq.**

**39-40) (فَاصْبِرْ عَلٰى مَا يَقُولُونَ) - Müşriklərin qiyaməti inkar edib, sənə tənə etmələrinə səbir et. Allah-Təala onları yenidən yaradıb, intiqam almağa da qadirdir. (وَسَبِّحْ بِحَمْدِ رَبِّكَ قَبْلَ طُلُوعِ الشَّمْسِ وَقَبْلَ الْغُرُوبِۚ)** - (Ey Məhəmməd), **rəbbin Allah-Təalanı günəşin doğmasından və batmasından əvvəl** (sübh və əsr namazında) **həmd-səna etməklə zikr et. (وَمِنَ الَّيْلِ فَسَبِّحْهُ وَاَدْبَارَ السُّجُودِ) Gecə vaxtında və hər bir namazlardan sonra da Allah-Təalanı zikr et.**

**41) (وَاسْتَمِعْ يَوْمَ يُنَادِ الْمُنَادِ مِنْ مَكَانٍ قَرِيبٍۙ)** - (Ey Məhəmməd), **qulaq asıb, qiyamət gününün xəbərlərini eşit. O gündə ki,** (qiyamət günündə) **onların yatdıqları məkana yaxın bizim tərəfimizdən carçı onları çağırar, hamısı qalxıb qəbirdən çıxar.**

**42) (يَوْمَ يَسْمَعُونَ الصَّيْحَةَ بِالْحَقِّۜ ذٰلِكَ يَوْمُ الْخُرُوجِ) - O gün ki, haqq olan qiyamətin vaqe olmağına bizim tərəfimizdən car çəkənin səsini eşitdilər, ogünkü gün qəbirdən çıxıb, məhşərə varid olmaq günüdür.**

إِنَّا نَحْنُ نُحْيِي وَنُمِيتُ وَإِلَيْنَا الْمَصِيرُ ﴿٤٣﴾ يَوْمَ تَشَقَّقُ الْأَرْضُ عَنْهُمْ سِرَاعًا ۚ ذَٰلِكَ حَشْرٌ عَلَيْنَا
يَسِيرٌ ﴿٤٤﴾ نَحْنُ أَعْلَمُ بِمَا يَقُولُونَ ۖ وَمَا أَنْتَ عَلَيْهِمْ بِجَبَّارٍ ۖ فَذَكِّرْ بِالْقُرْآنِ مَنْ يَخَافُ وَعِيدِ ﴿٤٥﴾

---

**43)** (إِنَّا نَحْنُ نُحْيِي وَنُمِيتُ وَإِلَيْنَا الْمَصِيرُ) - (Ey Məhəmməd), **həqiqətən, dirildib öldürən bizik və bütün məxluqatın dönüşü də bizim tərəfimizə olacaqdır.**

**44)** (يَوْمَ تَشَقَّقُ الْأَرْضُ عَنْهُمْ سِرَاعًا ۚ ذَٰلِكَ حَشْرٌ عَلَيْنَا يَسِيرٌ) **- O gün ki, yer onlardan ayrılıb parçalanacaq, insanlar hamısı yerlərindən qalxıb sürətlə məhşərə varid olarlar, onları bir yerə cəm edərik. Bu elə bir cəm etməkdir ki, bizə asan olar. Heç bir zəhmət və məşəqqəti yoxdur.**

**45)** (نَحْنُ أَعْلَمُ بِمَا يَقُولُونَ) - (Ey Məhəmməd), **müşriklərin sənə tənə edib, dedikləri sözlərinə biz agahıq. Onları bizə həvalə et. Biz özümüz onlardan intiqam alarıq.** (وَمَا أَنْتَ عَلَيْهِمْ بِجَبَّارٍ) **Sən onlara zülm edən deyilsən ki, zorla onları islama daxil edəsən. İslama daxil olmaq hər bir şəxsin öz ixtiyarındadır.** (فَذَكِّرْ بِالْقُرْآنِ مَنْ يَخَافُ وَعِيدِ) **Sən müjdələyən və qorxudansan. Ancaq o şəxs ki, mənim əzabımdan qorxur, onu Quranın öyüd-nəsihətləri ilə agah edib, bizim tərəfimizə dəvət et. Amma inadkar* şəxslərə Quran təsir edən deyildir.**

**(*Qeyd:** *"İnadkarlara nə Allah-Təalanın kitabı, nə peyğəmbərlərin, nə də övliyaların öyüd-nəsihəti təsir etməz. Necə ki, bizim bu zamanda Qurani-Şərifin ehkamını inadkarlara bildirəndə, adlarını Quran əhli qoysalar da, üz döndərib qaçarlar, lakin rəis adlanan din və şəriət pozucuları özlərinə mənfəət olsun deyə xalqı Quranın ehkamından döndərib, avam camaata Quranı bir tapmaca, müəmma bir şey kimi göstərib, guya onun mənasını və məqsədini dərk etmək olmaz deyirlər və bu səbəbdən Quranı tərk edib, uydurma rəvayətlərə əməl etmək rəvac tapıb, din və məzhəb ehkamı rəvayətlərə əsaslandığından naqis qalıb, inkişaf etmir. Bəli, rəislərin söz və əməlləri Quranın ehkamına zidd olduğundan məcburdurlar ki, xalqı Qurandan döndərsinlər, yox, əgər xalq Qurana yönəlsə, yalan və xurafata heç kim qulaq asmayıb, boş və batil sözlər rəvac tapmayacaqdır. Gərək islam ümməti diqqətli olub, Qurani-Şərifdən başqa sözlərə yönəlməsin. Hökm Quranın hökmüdür. Quranın hökmünə müxalifət edən şəxsdə nə din qalar, nə iman. Quranı tərk edənin üzrxahlığı qəbul edilməz. Quranın ehkamını gizlədənlər islamın düşmənidir).*

**Allaha həmd olsun. Qaf surəsinin təfsiri tamamlandı. Qurani-Şərifi ta axıra kimi təfsir etməyə Allah-Təaladan yardım istəyirəm. Allahın Rəsulu buyurubdur: "Kim Qaf surəsini oxusa, ölüm ona asan gələr.**

## əz-ZARİYAT SURƏSİ

51-ci surədir. Məkkədə nazil olub, 60 ayə, 360 kəlmə və 1239 hərfdir.

وَالذَّارِيَاتِ ذَرْوًا ۙ ﴿١﴾ فَالْحَامِلَاتِ وِقْرًا ۙ ﴿٢﴾ فَالْجَارِيَاتِ يُسْرًا ۙ ﴿٣﴾ فَالْمُقَسِّمَاتِ اَمْرًا ۙ ﴿٤﴾
اِنَّمَا تُوعَدُونَ لَصَادِقٌ ۙ ﴿٥﴾ وَاِنَّ الدِّينَ لَوَاقِعٌ ۜ ﴿٦﴾ وَالسَّمَآءِ ذَاتِ الْحُبُكِ ۙ ﴿٧﴾ اِنَّكُمْ لَفِي قَوْلٍ
مُخْتَلِفٍ ۙ ﴿٨﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (وَالذَّارِيَاتِ ذَرْوًا ۙ) -And olsun o küləklərə ki, toz-torpağa və toz- torpaqdan başqasına hərəkət verib qaldırırlar.**

**2) (فَالْحَامِلَاتِ وِقْرًا ۙ) - Və and olsun o buludlara ki, su gətirmək səbəbi ilə ağırlaşırlar.**

**3) (فَالْجَارِيَاتِ يُسْرًا ۙ) -Və and olsun o bürclərə ki, asan yolla axıb gedirlər.**

**4) (فَالْمُقَسِّمَاتِ اَمْرًا ۙ) - Və and olsun o mələklərə ki, yağışları və ruziləri və onlardan başqa insanlara lazım olan şeyləri bölüşdürürlər.**

**5) (اِنَّمَا تُوعَدُونَ لَصَادِقٌ) - Həqiqətən, o şey ki,** (qiyamət günü) **sizə vəd edilir, əlbəttə, doğrudur.**

**6) (وَاِنَّ الدِّينَ لَوَاقِعٌ) - Və həqiqətən, hər bir əmələ əvəz vermək o gündə vaqe olacaqdır. Ayələrin mənasını təfsirçilər belə yozsalar da, lakin ayələrin həqiqi mənaları belədir ki, bəhs olunur: (وَالذَّارِيَاتِ ذَرْوًا ۙ) - and olsun o müqəddəs nəfslərə ki, elmi xalqın arasında** (külək toz-torpağı dağıdan kimi) **hərəkət verib yayırlar. (فَالْحَامِلَاتِ وِقْرًا ۙ) - Və and olsun o nəfslərə ki, elmləri əldə etmək səbəbinə müqəddəs olub onların qüvvəsilə ağırlaşırlar. (فَالْجَارِيَاتِ يُسْرًا ۙ) - Və and olsun o nəfslərə ki, elm səbəbinə xalqın arasına asanlıqla girib, onları haqqa dəvət edib, xalqın əziyyət etməsini özlərinə məşəqqət saymırlar. (فَالْمُقَسِّمَاتِ اَمْرًا) - Və and olsun o nəfslərə ki, Allah-Təalanın əmrlərini insanlara çatdırıb, hər bir şəxsin vəzifəsini ona bəyan edirlər. Qurani-Şərif doğruluğu və hidayəti əmr edən bir kitab olduğuna görə, belə böyük faydaları tərk edib, belə açıq-aydın ayələrə boş mənalar verməyin nə faydası var?**

**7-8) (وَالسَّمَآءِ ذَاتِ الْحُبُكِ ۙ اِنَّكُمْ لَفِي قَوْلٍ مُخْتَلِفٍ ۙ) - And olsun müxtəlif yollar sahibi olan göyə ki, ulduzlarla bəzənmişdir. Həqiqətən, siz Qüreyş camaatı** (Məkkə əhli) **Məhəmməd haqqında müxtəlif sözlər deməkdə sabit və bərqərarsınız. Gah şair, gah sehrbaz və kahin, gah da dəli deyirsiniz.**

يُؤْفَكُ عَنْهُ مَنْ اُفِكَ ﴿٩﴾ قُتِلَ الْخَرَّاصُونَ ﴿١٠﴾ اَلَّذِينَ هُمْ فِي غَمْرَةٍ سَاهُونَ ﴿١١﴾ يَسْـَٔلُونَ
اَيَّانَ يَوْمُ الدِّينِ ﴿١٢﴾ يَوْمَ هُمْ عَلَى النَّارِ يُفْتَنُونَ﴿١٣﴾ ذُوقُوا فِتْنَتَكُمْ هٰذَا الَّذِي كُنْتُمْ بِهِ
تَسْتَعْجِلُونَ﴿١٤﴾ اِنَّ الْمُتَّقِينَ فِي جَنَّاتٍ وَعُيُونٍ ﴿١٥﴾ اٰخِذِينَ مَٓا اٰتٰيهُمْ رَبُّهُمْ اِنَّهُمْ كَانُوا قَبْلَ
ذٰلِكَ مُحْسِنِينَ ﴿١٦﴾ كَانُوا قَلِيلًا مِنَ الَّيْلِ مَا يَهْجَعُونَ﴿١٧﴾ وَبِالْاَسْحَارِ هُمْ يَسْتَغْفِرُونَ﴿١٨﴾
وَفِيٓ اَمْوَالِهِمْ حَقٌّ لِلسَّٓائِلِ وَالْمَحْرُومِ﴿١٩﴾

---

**9-10-11) (يُؤْفَكُ عَنْهُ مَنْ اُفِكَ) - Qurana iman etməkdən son dərəcə şiddətlə geri döndərilir hər o şəxs ki, döndərildi, (nəfsləri onları qaytardı), o döndərilənlər bir daha iman edən deyildir.**

**(قُتِلَ الْخَرَّاصُونَ اَلَّذِينَ هُمْ فِي غَمْرَةٍ سَاهُونَ) - Özlərindən düzəldib olmayan şeyi** (Məhəmmədə) **yalandan isnad edənlər öldürülsün, onlara lənət olsun. Onlar elə şəxslərdirlər ki, cəhalətə qərq olub, qəflətdə qalarlar.**

**12) (يَسْـَٔلُونَ اَيَّانَ يَوْمُ الدِّينِ)** - (Ey Məhəmməd), **istehza üçün səndən soruşarlar: "Cəza günü** (qiyamət günü) **nə vaxtdır?**

**13) (يَوْمَ هُمْ عَلَى النَّارِ يُفْتَنُونَ) - Qiyamət günü o gündür ki, cəhənnəm oduna daxil olub, əzab ediləcəklər.**

**14) (ذُوقُوا فِتْنَتَكُمْ هٰذَا الَّذِي كُنْتُمْ بِهِ تَسْتَعْجِلُونَ) - Əzab olunan vaxt onlara deyilər: "Əzabınızı dadın, bu həmin əzabdır ki, dünyada istehza edib, bu əzabın tez vaqe olmasını istəyirdiniz. Bu sizin məqamınızdır. İndi baxıb görək müttəqilərə nə məqam vermişəm.**

**15) (اِنَّ الْمُتَّقِينَ فِي جَنَّاتٍ وَعُيُونٍ) - Həqiqətən, müttəqilər ağaclarının altından çaylar axan cənnətlərdə yaşayarlar.**

**16) (اٰخِذِينَ مَٓا اٰتٰيهُمْ رَبُّهُمْ اِنَّهُمْ كَانُوا قَبْلَ ذٰلِكَ مُحْسِنِينَ) - Hər bir əcr və savabı ki, rəbləri Allah-Təala müttəqilərə verər, gözəl və pak olduğu üçün hamısını şövqlə qəbul edib razı olarlar. Belə əcr və savab dünyada yaxşı əməl sahibi olduqları üçün müttəqilərə verilər.**

**17) (كَانُوا قَلِيلًا مِنَ الَّيْلِ مَا يَهْجَعُونَ) - Müttəqilərin əməli dünyada belədir ki, gecə bir az yatıb, ondan sonra ibadətlə məşğul olardılar.**

**18) (وَبِالْاَسْحَارِ هُمْ يَسْتَغْفِرُونَ) - Səhər vaxtı** (hansı ki, duaların qəbul olunma vaxtıdır) **Allah-Təaladan əfv istəyərdilər.**

**19) (وَفِيٓ اَمْوَالِهِمْ حَقٌّ لِلسَّٓائِلِ وَالْمَحْرُومِ) - Mallarından həm dilənçi, həm də utandıqlarından istəməyib məhrum olanlara haqlarını verərlər. İstəməyən şəxsi də tapıb, onun haqqını ona verərlər.**

وَفِي الْاَرْضِ اٰيَاتٌ لِلْمُوقِنِينَۙ ﴿٢٠﴾ وَفِي اَنْفُسِكُمْۜ اَفَلَا تُبْصِرُونَ ﴿٢١﴾ وَفِي السَّمَاءِ رِزْقُكُمْ وَمَا
تُوعَدُونَ ﴿٢٢﴾ فَوَرَبِّ السَّمَاءِ وَالْاَرْضِ اِنَّهُ لَحَقٌّ مِثْلَ مَا اَنَّكُمْ تَنْطِقُونَ ﴿٢٣﴾ هَلْ اَتٰيكَ حَدِيثُ
ضَيْفِ اِبْرٰهِيمَ الْمُكْرَمِينَ ﴿٢٤﴾ اِذْ دَخَلُوا عَلَيْهِ فَقَالُوا سَلَامًاۜ قَالَ سَلَامٌۚ قَوْمٌ مُنْكَرُونَ ﴿٢٥﴾ فَرَاغَ
اِلٰى اَهْلِهِ فَجَاءَ بِعِجْلٍ سَمِينٍۙ ﴿٢٦﴾ فَقَرَّبَهُ اِلَيْهِمْ قَالَ اَلَا تَأْكُلُونَ ﴿٢٧﴾ فَاَوْجَسَ مِنْهُمْ خِيفَةًۜ قَالُوا
لَا تَخَفْۜ وَبَشَّرُوهُ بِغُلَامٍ عَلِيمٍ ﴿٢٨﴾

---

**20) (وَفِي الْاَرْضِ اٰيَاتٌ لِلْمُوقِنِينَ)** - (Ey Məhəmməd), **yer üzündə müvəhhidlərdən ötrü bizim tövhid və qüdrətimizə işarə edən dəlil və sübutlar vardır ki, elm və mərifətlə o sübutlar kəşf olunur.**

**21) (وَفِي اَنْفُسِكُمْ اَفَلَا تُبْصِرُونَ) - Bir də sizin özünüzün ilk öncə yaradılıb, bir haldan başqa bir hala keçməsində tövhid və qüdrətimizə dəlil və sübutlar vardır. Bəs ibrət nəzərilə baxıb görmürsünüz ki, ibrət alasınız?**

**22) (وَفِي السَّمَاءِ رِزْقُكُمْ وَمَا تُوعَدُونَ) - Dünyada ruziləriniz və axirətdə sizə vəd edilən savab və cəza hamısı göydə** (uca məqamda) **təqdir edilib, lövhiməhfuzda qeyd olunubdur.**

**23) (فَوَرَبِّ السَّمَاءِ وَالْاَرْضِ اِنَّهُ لَحَقٌّ مِثْلَ مَا اَنَّكُمْ تَنْطِقُونَ) - And olsun göyün və yerin tərbiyə verən rəbbinə, necə ki, siz danışırsınız və bu danışmağınız sizin üçün həqiqətdir, habelə sizə vəd edilən əmrlər də elə haqq və dəqiqdir. Onlarda heç bir şəkk və şübhə yoxdur.**

**24) (هَلْ اَتٰيكَ حَدِيثُ ضَيْفِ اِبْرٰهِيمَ الْمُكْرَمِينَ)** - (Ey Məhəmməd), **bəs İbrahimin əziz, hörmətli qonaqlarının hekayələri sənə gəlib çatmadımı? Əlbəttə, çatdı. Onların hekayəsi belədir.**

**25) (اِذْ دَخَلُوا عَلَيْهِ فَقَالُوا سَلَامًا قَالَ سَلَامٌ قَوْمٌ مُنْكَرُونَ) - Elə ki, bizim tərəfimizdən göndərilən mələklər İbrahimin yanına daxil oldular, salam verdilər, İbrahim də cavabında onlara salam verib, öz-özünə dedi: "Bunları tanımıram, bəs bunlar kimdir?** (İbrahim (ə.s) qonaq gələn kimi ona yemək gətirərdi, adət üzrə onlardan da bir şey soruşmayıb yemək gətirməyə getdi).

**26) (فَرَاغَ اِلٰى اَهْلِهِ فَجَاءَ بِعِجْلٍ سَمِينٍ) - Qonaqlardan gizlin** (İbrahim) **ailəsinin yanına gedib əmr etdi, yağlı bir kök buzovu onlardan ötrü kabab edib gətirdi.** (Mələklər insan surətində idilər).

**27) (فَقَرَّبَهُ اِلَيْهِمْ) Yeməyi gətirib onların qabağına qoydu. Onlar yemədilər. (قَالَ اَلَا تَأْكُلُونَ) - İbrahim dedi: "Bəs yemək yemirsiniz?**

**28) (فَاَوْجَسَ مِنْهُمْ خِيفَةً) - Onların yemək yeməmələrindən İbrahimin qəlbinə qorxu düşdü. (قَالُوا لَا تَخَفْ وَبَشَّرُوهُ بِغُلَامٍ عَلِيمٍ) - Mələklərə İbrahimin qorxması məlum olanda dedilər: "Qorxma, biz mələikəyik, insan deyilik,**

فَاَقْبَلَتِ امْرَاَتُهُ فٖي صَرَّةٍ فَصَكَّتْ وَجْهَهَا وَقَالَتْ عَجُوزٌ عَقٖيمٌ ﴿٢٩﴾قَالُوا كَذٰلِكِۙ قَالَ رَبُّكِ ۜ اِنَّهُ هُوَ
الْحَكٖيمُ الْعَلٖيمُ ﴿٣٠﴾ قَالَ فَمَا خَطْبُكُمْ اَيُّهَا الْمُرْسَلُونَ﴿٣١﴾ قَالُوٓا اِنَّٓا اُرْسِلْنَٓا اِلٰى قَوْمٍ مُجْرِمٖينَ
ۙ﴿٣٢﴾ لِنُرْسِلَ عَلَيْهِمْ حِجَارَةً مِنْ طٖينٍۙ﴿٣٣﴾ مُسَوَّمَةً عِنْدَ رَبِّكَ لِلْمُسْرِفٖينَ﴿٣٤﴾ فَاَخْرَجْنَا مَنْ
كَانَ فٖيهَا مِنَ الْمُؤْمِنٖينَۚ ﴿٣٥﴾ فَمَا وَجَدْنَا فٖيهَا غَيْرَ بَيْتٍ مِنَ الْمُسْلِمٖينَۚ ﴿٣٦﴾

---

**ondan sonra İbrahimə bilgili bir oğul müjdəsi verdilər: “Allah-Təala bu** (Saradan) **sənə bir oğul** (İshaq) **bəxş edəcəkdir.** (Sara orada durmuşdu, yaşı keçib qocalıq halında uşaq doğmaq əlaməti qəfildən onda meydana gəldi).

**29) (فَاَقْبَلَتِ امْرَاَتُهُ فٖي صَرَّةٍ فَصَكَّتْ وَجْهَهَا وَقَالَتْ عَجُوزٌ عَقٖيمٌ) -** (Sara) **oğul müjdəsini eşidən kimi təəccüb edib, dad-fəryad etməyə** (necə ki, qadınların adətidir) **başlayıb, üzünə vurub dedi: “Doğmayan qadınam, qocayam, necə övladım ola bilər?**

**30) (قَالُوا كَذٰلِكِۙ) - Mələklər dedilər: “Bu, dediyin kimi belədir, qoca qadının övladı olmaz.**

**(قَالَ رَبُّكِ ۜ اِنَّهُ هُوَ الْحَكٖيمُ الْعَلٖيمُ) - Amma sənin rəbbin Allah-Təala buyurubdur ki, mən ona oğul verməyə qadirəm. Həqiqətən, Allah-Təaladan hər bir şey hikmət üzrə meydana gələr və hər bir şeyə agahdır.**

**31) (قَالَ فَمَا خَطْبُكُمْ اَيُّهَا الْمُرْسَلُونَ) - Elə ki, İbrahim məlaikəni onların müjdə verməsindən tanıdı, onlardan soruşub dedi: “Ey Allah-Təala tərəfindən göndərilənlər, sizin işiniz nədir və nədən ötrü gəlibsiniz?**

**32) (قَالُوٓا اِنَّٓا اُرْسِلْنَٓا اِلٰى قَوْمٍ مُجْرِمٖينَ) - Mələklər dedilər: “Bizi Allah-Təala bir günahkar qövmə** (Lut qövmünə) **göndəribdir.**

**33) (لِنُرْسِلَ عَلَيْهِمْ حِجَارَةً مِنْ طٖينٍۙ) - Ta ki, Allah-Təalanın izni ilə daş kimi qurumuş palçığı onların üzərinə yağış kimi töküb, onları həlak edək.**

**34) (مُسَوَّمَةً عِنْدَ رَبِّكَ لِلْمُسْرِفٖينَ) - O palçıq daşlar küfr və şirkdə tüğyan edənlərə əzab etməkdən ötrü sənin rəbbin Allah-Təalanın yanında nişanlanmışdır.**

**35) (فَاَخْرَجْنَا مَنْ كَانَ فٖيهَا مِنَ الْمُؤْمِنٖينَ)** - (Ey Məhəmməd), **Lut qövmünə əzab göndərib, o bölgədə olan mömինləri oradan çıxarıb, ondan sonra kafirləri həlak etdik.**

**36) (فَمَا وَجَدْنَا فٖيهَا غَيْرَ بَيْتٍ مِنَ الْمُسْلِمٖينَ) - O bölgədə bizə itaət edənlərdən bircə evdən** (Lut evindən) **başqa ev tapmadıq.** (Lut yeddi şəhər əhlinə göndərilmişdi, onlardan bir nəfər imana daxil olmadı, lakin möminlər Lut və iki qızından ibarət idi).

وَتَرَكْنَا فِيهَآ اٰيَةً لِلَّذٖينَ يَخَافُونَ الْعَذَابَ الْاَلٖيمَۜ ﴿٣٧﴾وَفٖي مُوسٰى اِذْ اَرْسَلْنَاهُ اِلٰى فِرْعَوْنَ بِسُلْطَانٍ
مُبٖينٍ ﴿٣٨﴾ فَتَوَلّٰى بِرُكْنِهٖ وَقَالَ سَاحِرٌ اَوْ مَجْنُونٌ ﴿٣٩﴾ فَاَخَذْنَاهُ وَجُنُودَهُ فَنَبَذْنَاهُمْ فِي الْيَمِّ وَهُوَ
مُلٖيمٌۜ ﴿٤٠﴾ وَفٖي عَادٍ اِذْ اَرْسَلْنَا عَلَيْهِمُ الرّٖيحَ الْعَقٖيمَۚ ﴿٤١﴾ مَا تَذَرُ مِنْ شَيْءٍ اَتَتْ عَلَيْهِ اِلَّا جَعَلَتْهُ
كَالرَّمٖيمِۜ ﴿٤٢﴾ وَفٖي ثَمُودَ اِذْ قٖيلَ لَهُمْ تَمَتَّعُوا حَتّٰى حٖينٍ ﴿٤٣﴾فَعَتَوْا عَنْ اَمْرِ رَبِّهِمْ فَاَخَذَتْهُمُ
الصَّاعِقَةُ وَهُمْ يَنْظُرُونَ ﴿٤٤﴾

---

**37) (وَتَرَكْنَا فِيهَآ اٰيَةً لِلَّذٖينَ يَخَافُونَ الْعَذَابَ الْاَلٖيمَ) - Allah-Təalanın əziyyət verən əzabından qorxanlardan ötrü həmin bölgədə onların həlak olmasına işarə edən əlamətlər qoyduq ki, onlardan ibrət alıb, Allah-Təalaya asi olmasınlar.**

**38) (وَفٖي مُوسٰى اِذْ اَرْسَلْنَاهُ اِلٰى فِرْعَوْنَ بِسُلْطَانٍ مُبٖينٍ) -** (Ey Məhəmməd), **o zaman ki, Musanı haqq olmasına zahir və aşkar olan dəlil və sübutla firona göndərdik, onun göndərilməsində ibrət alanlardan ötrü bizim tövhid və qüdrətimizə dəlil və sübut var idi.**

**39) (فَتَوَلّٰى بِرُكْنِهٖ وَقَالَ سَاحِرٌ اَوْ مَجْنُونٌ) - Firon o dəlillərə baxmayıb təkəbbürlənib, camaat və qoşunu ilə iman etməkdən üz döndərib dedi: "Musa ya sehrbazdır, ya da dəli, ona peyğəmbər demək xətadır.**

**40) (فَاَخَذْنَاهُ وَجُنُودَهُ فَنَبَذْنَاهُمْ فِي الْيَمِّ وَهُوَ مُلٖيمٌ) - Fironun özünü və qoşununu tutub dənizə atıb qərq etdik, firondan elə əməllər** (küfr və şirk) **meydana gəlmişdi ki, məzəmmətə və töhmətə layiq idi.**

**41) (وَفٖي عَادٍ اِذْ اَرْسَلْنَا عَلَيْهِمُ الرّٖيحَ الْعَقٖيمَ) -** (Ey Məhəmməd), **o zaman ki, Ad** (Hud peyğəmbərin) **camaatına** (nə vaxt ki, bizə asi olub Huda itaət etmədilər) **xeyir və bərəkəti olmayan külək** (qərb küləyi) **göndərib onları həlak etdik, onların həlak olmasında ibrət alıb bizim tövhid və qüdrətimizə agah olanlardan ötrü dəlil və sübut var idi.**

**42) (مَا تَذَرُ مِنْ شَيْءٍ اَتَتْ عَلَيْهِ اِلَّا جَعَلَتْهُ كَالرَّمٖيمِ) - O külək elə şiddətli idi ki, onların nəfslərindən və ya mallarından nəyə toxunurdu, onu öz halında qoymayıb, çürümüş köhnə bir şey kimi edirdi.**

**43) (وَفٖي ثَمُودَ اِذْ قٖيلَ لَهُمْ تَمَتَّعُوا حَتّٰى حٖينٍ) -** (Ey Məhəmməd), **o zaman ki,** (Saleh) **peyğəmbər Səmud camaatını dəvət etdi, qəbul etməyib asi oldular. Saleh Allah-Təala tərəfindən onlara əzab vədi verib dedi: "Bir vaxta qədər** (on üç günə qədər) **dünyada ləzzət alın, ondan sonra sizə əzab ediləcəkdir.** (On üç gündən sonra əzab göndərib hamısını həlak etdik). **Səmud camaatının həlak olmasında ibrət alıb, bizim tövhid və qüdrətimizə agah olanlardan ötrü dəlil və sübut var idi.**

**44) (فَعَتَوْا عَنْ اَمْرِ رَبِّهِمْ فَاَخَذَتْهُمُ الصَّاعِقَةُ وَهُمْ يَنْظُرُونَ) - Səmud camaatı təkəbbür-**

فَمَا اسْتَطَاعُوا مِنْ قِيَامٍ وَمَا كَانُوا مُنْتَصِرِينَ ﴿٤٥﴾ وَقَوْمَ نُوحٍ مِنْ قَبْلُ اِنَّهُمْ كَانُوا قَوْمًا فَاسِقِينَ ﴿٤٦﴾ وَالسَّمَٓاءَ بَنَيْنَاهَا بِاَيْدٍ وَاِنَّا لَمُوسِعُونَ ﴿٤٧﴾ وَالْاَرْضَ فَرَشْنَاهَا فَنِعْمَ الْمَاهِدُونَ ﴿٤٨﴾ وَمِنْ كُلِّ شَيْءٍ خَلَقْنَا زَوْجَيْنِ لَعَلَّكُمْ تَذَكَّرُونَ ﴿٤٩﴾ فَفِرُّٓوا اِلَى اللّٰهِ اِنّ۪ي لَكُمْ مِنْهُ نَذ۪يرٌ مُب۪ينٌ ﴿٥٠﴾ وَلَا تَجْعَلُوا مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ اِنّ۪ي لَكُمْ مِنْهُ نَذ۪يرٌ مُب۪ينٌ ﴿٥١﴾ كَذٰلِكَ مَٓا اَتَى الَّذ۪ينَ مِنْ قَبْلِهِمْ مِنْ رَسُولٍ اِلَّا قَالُوا سَاحِرٌ اَوْ مَجْنُونٌ ﴿٥٢﴾ اَتَوَاصَوْا بِه۪ بَلْ هُمْ قَوْمٌ طَاغُونَ ﴿٥٣﴾

---

**lənib, rəbləri Allah-Təalanın əmrindən çıxdılar. Özləri baxıb gördükləri halda onları şiddətli səsin əzabı tutub, həlak oldular.**

**45) (فَمَا اسْتَطَاعُوا مِنْ قِيَامٍ وَمَا كَانُوا مُنْتَصِرِينَ) - Əzab göndəriləndən sonra nə əzabdan qalxıb durmağa qüdrətləri olmayıb, nə də əzabdan imtina edib qurtulan da deyildirlər.**

**46) (وَقَوْمَ نُوحٍ مِنْ قَبْلُ اِنَّهُمْ كَانُوا قَوْمًا فَاسِقِينَ)** - (Ey Məhəmməd), **onlardan əvvəl Nuh peyğəmbərin qövmünü həlak etdik, həqiqətən, onun qövmü fasiq bir camaat idi.**

**47) (وَالسَّمَٓاءَ بَنَيْنَاهَا بِاَيْدٍ وَاِنَّا لَمُوسِعُونَ)** - (Ey Məhəmməd), **asiləri həlak etməyə qadir olan kimi hər bir şeyin yaradılmasına da qadirik. O cümlədən göyü özümüzə məxsus olan qüvvət və qüdrətlə yaratdıq və həqiqətən, əlbəttə biz hər bir şeyi yaradıb, genişləndirməyə də qadirik.**

**48) (وَالْاَرْضَ فَرَشْنَاهَا فَنِعْمَ الْمَاهِدُونَ) - Yeri siz insan nəslindən ötrü döşədik ki, onda həyat sürəsiniz və biz nə yaxşı, gözəl vəchlə hər bir şeyi hazır edənik.**

**49) (وَمِنْ كُلِّ شَيْءٍ خَلَقْنَا زَوْجَيْنِ لَعَلَّكُمْ تَذَكَّرُونَ) - Hər bir heyvanatdan sizin kimi cüt-cüt** (erkək və dişi) **yaratdıq ki, ibrət alıb, bizim tövhid və qüdrətimizə agah olasınız.**

**50) (فَفِرُّٓوا اِلَى اللّٰهِ اِنّ۪ي لَكُمْ مِنْهُ نَذ۪يرٌ مُب۪ينٌ)** - (Ey Məhəmməd), **insanlara de ki, Allah-Təalanın əzab və müsibətindən itaət və savabına tərəf qaçın, həqiqətən, mən Allah-Təala tərəfindən olub, sizi onun əzabı ilə açıq-aşkar qorxudanam.**

**51) (وَلَا تَجْعَلُوا مَعَ اللّٰهِ اِلٰهًا اٰخَرَ اِنّ۪ي لَكُمْ مِنْهُ نَذ۪يرٌ مُب۪ينٌ) - Özünüzə Allah-Təala ilə birlikdə başqa batil məbud seçməyin, məhz bu əmrdən ötrü mən sizi Allah-Təalanın əzabından açıq-aşkar qorxudanam.**

**52) (كَذٰلِكَ مَٓا اَتَى الَّذ۪ينَ مِنْ قَبْلِهِمْ مِنْ رَسُولٍ اِلَّا قَالُوا سَاحِرٌ اَوْ مَجْنُونٌ)** - (Ey Məhəmməd), **bu Qüreyş camaatı səni təkzib edən kimi onlardan əvvəlki ümmətlərə də bir peyğəmbər gəldikdə, o peyğəmbərin haqqında da ya sehrbaz, ya da dəli dedilər.**

**53) (اَتَوَاصَوْا بِه۪ بَلْ هُمْ قَوْمٌ طَاغُونَ) - Bəs əvvəlkilər və bu Qüreyş camaatı**

فَتَوَلَّ عَنْهُمْ فَمَآ اَنْتَ بِمَلُومٍ ﴿٥٤﴾ وَذَكِّرْ فَاِنَّ الذِّكْرٰى تَنْفَعُ الْمُؤْمِنِينَ ﴿٥٥﴾ وَمَا خَلَقْتُ الْجِنَّ
وَالْاِنْسَ اِلَّا لِيَعْبُدُونِ ﴿٥٦﴾ مَآ اُرِيدُ مِنْهُمْ مِنْ رِزْقٍ وَمَآ اُرِيدُ اَنْ يُطْعِمُونِ ﴿٥٧﴾ اِنَّ اللّٰهَ هُوَ الرَّزَّاقُ
ذُو الْقُوَّةِ الْمَتِينُ ﴿٥٨﴾ فَاِنَّ لِلَّذِينَ ظَلَمُوا ذَنُوبًا مِثْلَ ذَنُوبِ اَصْحَابِهِمْ فَلَا يَسْتَعْجِلُونِ ﴿٥٩﴾ فَوَيْلٌ
لِلَّذِينَ كَفَرُوا مِنْ يَوْمِهِمُ الَّذِي يُوعَدُونَ ﴿٦٠﴾

---

**bir-birinə vəsiyyət ediblər ki, hamısı peyğəmbərlərin haqqında bir söz** (sehrbaz və ya dəli) **desinlər? Yox, belə vəsiyyət etməyiblər. Bəlkə tüğyan və zəlalətdə şərik olduqları üçün hamısı bir söz deyirlər.**

**54) (فَتَوَلَّ عَنْهُمْ فَمَآ اَنْتَ بِمَلُومٍ)** - (Ey Məhəmməd), **sən ki, onları dəfələrlə dəvət edibsən, lakin onlara təsir etməyibdir, indi onlardan üz döndərib, daha dəvət etmə. Bu üz döndərməkdə sənə töhmət və məzəmmət yoxdur. Çünki peyğəmbərliyi təbliğ etməkdə gücün çatan qədər səy etdin.**

**55) (وَذَكِّرْ فَاِنَّ الذِّكْرٰى تَنْفَعُ الْمُؤْمِنِينَ)** - (Ey Məhəmməd), **lakin öyüd-nəsihət etməkdə davam et. Həqiqətən, nəsihət möminlərə fayda verib, imanlarını daha artırıb, möhkəm olarlar.**

**56) (وَمَا خَلَقْتُ الْجِنَّ وَالْاِنْسَ اِلَّا لِيَعْبُدُونِ)** - (Ey Məhəmməd), **cin və insanları yaratdım ki, ancaq təkcə mənə ibadət etsinlər və bu ibadət onların müvəhhidliyinə dəlil olduğundan axirət əzabından nicat taparlar.**

**57) (مَآ اُرِيدُ مِنْهُمْ مِنْ رِزْقٍ وَمَآ اُرِيدُ اَنْ يُطْعِمُونِ)** - (Ey Məhəmməd), **mənim işim bəndələrimlə rəftar etməkdə onların qulam və xidmətkarlar ilə rəftar etmələri kimi deyildir. Onlar xidmətçilərini öz faydalarından ötrü xidmətə vadar edirlər. Amma mən aləmlərin rəbbiyəm. Nə onlardan bir ruzi və nə də bir şeylə məni,** (heç möhtac da deyiləm), **nə də bəndələrimi yedizdirmələrini istəməmişəm. Əksinə, mən özüm onlara ruzi verib, onlardan ancaq ibadət və məni tanımalarını istəmişəm.**

**58) (اِنَّ اللّٰهَ هُوَ الرَّزَّاقُ ذُو الْقُوَّةِ الْمَتِينُ) - Həqiqətən, çox ruzi verib, qüvvət sahibi və qüvvətdə möhkəm və mətin olan Allah-Təaladır. Belə Allah-Təala heç bir şeydə özündən başqasına möhtac deyildir.**

**59) (فَاِنَّ لِلَّذِينَ ظَلَمُوا ذَنُوبًا مِثْلَ ذَنُوبِ اَصْحَابِهِمْ فَلَا يَسْتَعْجِلُونِ)** - (Ey Məhəmməd), **həqiqətən, o şəxslər ki, sənə zülm edib, səni təkzib edib müxtəlif adlar sənə qoydular, əvvəlki yoldaşlarının əzabdan payı olduğu kimi onların da əzabdan böyük payları vardır. Daha o əzabı istəməkdə tələsməsinlər, ən yaxın zamanda əzab gəlib onlara yetişəcəkdir.**

**60) (فَوَيْلٌ لِلَّذِينَ كَفَرُوا مِنْ يَوْمِهِمُ الَّذِي يُوعَدُونَ)** - (Ey Məhəmməd), **kafir olub səni təkzib edənlərə onlara vəd edilən günün** (qiyamət gününün) **əzabından vay olsun ki, nə şiddətli əzab onları tutacaqdır.**

Allaha həmd olsun, əz-Zariyat surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurubdur: *“Kim əz-Zariyat surəsini oxusa, Allah-Təala ona on xeyir (savab) bəxş edər.”*

## ət-TUR SURƏSİ

52-ci surədir. Məkkədə nazil olub, 49 ayə, 312 kəlmə və 1500 hərfdir.

وَالطُّورِۙ ﴿١﴾ وَكِتَابٍ مَسْطُورٍۙ ﴿٢﴾ فِي رَقٍّ مَنْشُورٍۙ ﴿٣﴾ وَالْبَيْتِ الْمَعْمُورِۙ ﴿٤﴾ وَالسَّقْفِ
الْمَرْفُوعِۙ ﴿٥﴾ وَالْبَحْرِ الْمَسْجُورِۙ ﴿٦﴾ اِنَّ عَذَابَ رَبِّكَ لَوَاقِعٌۙ ﴿٧﴾ مَا لَهُ مِنْ دَافِعٍۙ ﴿٨﴾ يَوْمَ تَمُورُ
السَّمَٓاءُ مَوْرًاۙ ﴿٩﴾ وَتَسِيرُ الْجِبَالُ سَيْرًاؕ ﴿١٠﴾ فَوَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَۙ ﴿١١﴾ اَلَّذِينَ هُمْ فِي خَوْضٍ
يَلْعَبُونَۢ ﴿١٢﴾ يَوْمَ يُدَعُّونَ اِلٰى نَارِ جَهَنَّمَ دَعًّاؕ ﴿١٣﴾ هٰذِهِ النَّارُ الَّتِي كُنْتُمْ بِهَا تُكَذِّبُونَ ﴿١٤﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (وَالطُّورِۙ) - And olsun Tur dağına ki, Allah-Təala o dağda səsi yaradıb, Musa ilə danışdı.**

**2) (وَكِتَابٍ مَسْطُورٍۙ فِي رَقٍّ مَنْشُورٍۙ) - Və and olsun səhifələrdə yazılıb nəşr olunan kitaba** (Qurana)

**4) (وَالْبَيْتِ الْمَعْمُورِۙ)- Və and olsun** (hacıların çox ziyarəti ilə abad olan beytullaha) (Kəbəyə)

**5) (وَالسَّقْفِ الْمَرْفُوعِۙ) - Və and olsun uca tavana (göyə)**

**6) (وَالْبَحْرِ الْمَسْجُورِۙ) - Və and olsun çoxlu heyvanlarla dolu olan dənizə.**

**7) (اِنَّ عَذَابَ رَبِّكَ لَوَاقِعٌ)** - (Ey Məhəmməd), **həqiqətən, sənin rəbbin Allah-Təalanın əzabı asilərə əlbəttə vaqe olacaqdır.**

**8) (مَا لَهُ مِنْ دَافِعٍۙ) - Və o əzabı onlardan dəf edən olmayacaqdır.**

**9) (يَوْمَ تَمُورُ السَّمَٓاءُ مَوْرًاۙ) - Əzab o gündə vaqe olar ki, o gündə göy bir növ iztirab, qarışıqlıq içində olar.**

**10) (وَتَسِيرُ الْجِبَالُ سَيْرًاؕ) - Dağlar hərəkət edib, bir növ seyr edərlər.**

**11) (فَوَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ) - Ogünkü gündə bizim peyğəmbərləri təkzib edənlərə vay olsun ki, şiddətli əzab onlara yetişəcəkdir.**

**12) (اَلَّذِينَ هُمْ فِي خَوْضٍ يَلْعَبُونَ) Təkzib edənlər o şəxslərdir ki, yalan və batilə daxil olub, qafil olduqları halda oyunla, əyləncə ilə məşğul olurlar.**

**13) (يَوْمَ يُدَعُّونَ اِلٰى نَارِ جَهَنَّمَ دَعًّا) - Əzab o gündə vaqe olar ki, o gündə asiləri şiddətlə dəf edib, cəhənnəm oduna salırlar.**

**14) (هٰذِهِ النَّارُ الَّتِي كُنْتُمْ بِهَا تُكَذِّبُونَ) - Cəhənnəmdə onlara deyilər: "Bu, həmin cəhənnəm odudur ki, dünyada onu təkzib edib, qəbul etməyirdiniz.**

اَفَسِحْرٌ هٰذَٓا اَمْ اَنْتُمْ لَا تُبْصِرُونَ﴿١٥﴾ اِصْلَوْهَا فَاصْبِرُوٓا اَوْ لَا تَصْبِرُواۚ سَوَٓاءٌ عَلَيْكُمْۜ اِنَّمَا تُجْزَوْنَ
مَا كُنْتُمْ تَعْمَلُونَ﴿١٦﴾ اِنَّ الْمُتَّقِينَ فِي جَنَّاتٍ وَنَع۪يمٍۙ ﴿١٧﴾ فَاكِه۪ينَ بِمَٓا اٰتٰيهُمْ رَبُّهُمْۚ وَوَقٰيهُمْ رَبُّهُمْ
عَذَابَ الْجَح۪يمِ ﴿١٨﴾ كُلُوا وَاشْرَبُوا هَن۪يٓـًٔا بِمَا كُنْتُمْ تَعْمَلُونَۙ ﴿١٩﴾ مُتَّكِـ۪ٔينَ عَلٰى سُرُرٍ مَصْفُوفَةٍۚ
وَزَوَّجْنَاهُمْ بِحُورٍ ع۪ينٍ ﴿٢٠﴾ وَالَّذ۪ينَ اٰمَنُوا وَاتَّبَعَتْهُمْ ذُرِّيَّتُهُمْ بِا۪يمَانٍ اَلْحَقْنَا بِهِمْ ذُرِّيَّتَهُمْ وَمَٓا اَلَتْنَاهُمْ
مِنْ عَمَلِهِمْ مِنْ شَيْءٍۜ كُلُّ امْرِئٍ بِمَا كَسَبَ رَه۪ينٌ ﴿٢١﴾ وَاَمْدَدْنَاهُمْ بِفَاكِهَةٍ وَلَحْمٍ مِمَّا يَشْتَهُونَ ﴿٢٢﴾

---

**15) (اَفَسِحْرٌ هٰذَٓا اَمْ اَنْتُمْ لَا تُبْصِرُونَ) Allah-Təala tərəfindən gələn Qurana sehrdir deyirdiniz, bəs indi bu cəhənnəm əzabı da sehrdirmi? Ya da ki, dünyada haqdan kor olan kimi burada da kor olub görmürsünüz?**

**16) (اِصْلَوْهَا فَاصْبِرُوٓا اَوْ لَا تَصْبِرُواۚ سَوَٓاءٌ عَلَيْكُمْ) - Cəhənnəmə daxil olub, əzab çəkin, əzaba səbir edin, ya etməyin, sizin üçün eynidir, heç vaxt sizin üçün yüngülləşdirilməyəcəkdir. (اِنَّمَا تُجْزَوْنَ مَا كُنْتُمْ تَعْمَلُونَ) Həqiqətən, sizə öz əməlinizin cəzası verilir.**

**17) (اِنَّ الْمُتَّقِينَ فِي جَنَّاتٍ وَنَع۪يمٍۙ)** - (Ey Məhəmməd), **asilərin əhvalı yad olundu. Bundan sonra müttəqilərin əhvalı bəyan olunur. Həqiqətən, müttəqilər necə kamil nemətlərdə və cənnətlərdə olacaqlar, vəsf etmək mümkün deyildir.**

**18) (فَاكِه۪ينَ بِمَٓا اٰتٰيهُمْ رَبُّهُمْۚ وَوَقٰيهُمْ رَبُّهُمْ عَذَابَ الْجَح۪يمِ) - Müttəqilər rəbləri Allah-Təalanın onlara verdiyi nemətlərlə ləzzət alıb, rəbləri onları cəhənnəm əzabından mühafizə edər.**

**19) (كُلُوا وَاشْرَبُوا هَن۪يٓـًٔا بِمَا كُنْتُمْ تَعْمَلُونَ)** - (Ey Məhəmməd), **bizim tərəfimizdən müttəqilərə deyilər: "Dünyada etdiyiniz xeyir əməllər səbəbi ilə behiştin nemətləri sizin üçün dadlı olduğu halda, onlardan yeyin və için.**

**20) (مُتَّكِـ۪ٔينَ عَلٰى سُرُرٍ مَصْفُوفَةٍۚ وَزَوَّجْنَاهُمْ بِحُورٍ ع۪ينٍ) - Bir sıra və nizamla qoyulan taxtlara söykənib, iri gözlü hurilərlə onları evləndirərik ki, onlar ilə həmsöhbət olsunlar.**

**21) (وَالَّذ۪ينَ اٰمَنُوا وَاتَّبَعَتْهُمْ ذُرِّيَّتُهُمْ) - Mömінləri də mömінlərə yoldaş və həmsöhbət edib, kiçik övladları da onlara tabe olub cənnətə daxil olarlar. Ta ki, hər bir cəhətdən sevincləri tam olsun. (بِا۪يمَانٍ اَلْحَقْنَا بِهِمْ ذُرِّيَّتَهُمْ) - Böyük və uca mərtəbədə olan iman** (ataların imanı) **səbəbinə onların kiçik övladlarını da onlara qatarıq. (وَمَٓا اَلَتْنَاهُمْ مِنْ عَمَلِهِمْ مِنْ شَيْءٍۜ كُلُّ امْرِئٍ بِمَا كَسَبَ رَه۪ينٌ) - Onların əməllərindən heç bir şey əskik olmaz. Hər bir kişi öz qazandığı əməlinin girovudur. Əgər əməli xeyir olsa, mükafat verilər. Ya əgər şər olsa, cəza verilər.**

**22) (وَاَمْدَدْنَاهُمْ بِفَاكِهَةٍ وَلَحْمٍ مِمَّا يَشْتَهُونَ) - Müttəqilərin istədikləri meyvədən, ətdən hər bir vaxt hazır edib onlara verərik.**

يَتَنَازَعُونَ فِيهَا كَاْسًا لَا لَغْوٌ فِيهَا وَلَا تَاْثِيمٌ ﴿٢٣﴾ وَيَطُوفُ عَلَيْهِمْ غِلْمَانٌ لَهُمْ كَاَنَّهُمْ لُؤْلُؤٌ مَكْنُونٌ
﴿٢٤﴾ وَاَقْبَلَ بَعْضُهُمْ عَلٰى بَعْضٍ يَتَسَٓاءَلُونَ﴿٢٥﴾ قَالُوٓا اِنَّا كُنَّا قَبْلُ فٖٓي اَهْلِنَا مُشْفِقِينَ﴿٢٦﴾ فَمَنَّ
اللّٰهُ عَلَيْنَا وَوَقٰينَا عَذَابَ السَّمُومِ ﴿٢٧﴾ اِنَّا كُنَّا مِنْ قَبْلُ نَدْعُوهُ اِنَّهُ هُوَ الْبَرُّ الرَّحٖيمُ ﴿٢٨﴾ فَذَكِّرْ
فَمَٓا اَنْتَ بِنِعْمَتِ رَبِّكَ بِكَاهِنٍ وَلَا مَجْنُونٍ ﴿٢٩﴾ اَمْ يَقُولُونَ شَاعِرٌ نَتَرَبَّصُ بِهٖ رَيْبَ الْمَنُونِ ﴿٣٠﴾

---

**23) (يَتَنَازَعُونَ فِيهَا كَاْسًا لَا لَغْوٌ فِيهَا وَلَا تَاْثِيمٌ) - Cənnətdə şərab qədəhini bir-birlərinin əlindən sanki höcətləşərək alıb içərlər. Amma onun içilməsindən dünya şərabı kimi nə boş və batil söz danışmaq, nə də sahibini günahkar edən əməl meydana gəlməz. Necə ki, dünya şərabını içənlərdə bu əməllər zühura gəlir.**

**24) (وَيَطُوفُ عَلَيْهِمْ غِلْمَانٌ لَهُمْ كَاَنَّهُمْ لُؤْلُؤٌ مَكْنُونٌ) Sədəf içində gizlənən mirvari kimi müttəqilərə məxsus olan qulamlar xidmət etməkdən ötrü onların ətrafına dolanıb, hər bir əmrlərinə itaət edərlər.**

**25) (وَاَقْبَلَ بَعْضُهُمْ عَلٰى بَعْضٍ يَتَسَٓاءَلُونَ) - Müttəqilər bir-birilərinə dönüb, söhbət edib, hal-əhval soruşarlar.**

**26) (قَالُوٓا اِنَّا كُنَّا قَبْلُ فٖٓي اَهْلِنَا مُشْفِقِينَ) Söhbət əsnasında bir-birilərinə deyərlər: “Həqiqətən, bundan əvvəl biz dünyada ailəmizin arasında olan zamanda Allah-Təalanın qorxusundan qəlbimiz mütəəssir olub, əzabdan qorxardıq.**

**27) (فَمَنَّ اللّٰهُ عَلَيْنَا وَوَقٰينَا عَذَابَ السَّمُومِ) Allah-Təala da bizim qorxumuza görə bizə minnət qoyub** (mərhəmət edib) **cəhənnəmin yanan alovlu odundan bizi mühafizə etdi.**

**28) (اِنَّا كُنَّا مِنْ قَبْلُ نَدْعُوهُ اِنَّهُ هُوَ الْبَرُّ الرَّحٖيمُ) Həqiqətən, biz bundan əvvəl dünya həyatında Allah-Təalaya dua və ibadət edirdik və həqiqətən, Allah-Təala ibadət edənlərə lütf edib, rəhməti onları ehtiva edər. Necə ki, rəhməti bizə şamil olub nicat tapdıq.**

**29) (فَذَكِّرْ فَمَٓا اَنْتَ بِنِعْمَتِ رَبِّكَ بِكَاهِنٍ وَلَا مَجْنُونٍ) -** (Ey Məhəmməd), **elə ki, cənnət və cəhənnəm sahiblərinin əhvalına agah oldun, xalqa öyüd-nəsihət etməkdə sabit və bərqərar ol. Sənə kahin, ya da dəli demələri səni peyğəmbərliyi təbliğ etməkdən səni saxlamasın. Bu peyğəmbərlik nemətidir ki, Allah-Təala sənə bəxş edibdir, sən nə kahin və nə də dəli deyilsən.**

**30) (اَمْ يَقُولُونَ شَاعِرٌ نَتَرَبَّصُ بِهٖ رَيْبَ الْمَنُونِ) Ya da ki, deyirlər:** (Məhəmməd) **şairdir, zəmanənin gərdişini gözləyirik ki, o da digər şairlər** (Züheyir, Nabiğə, Əntərə) **kimi həlak olub getsin.**

قُلْ تَرَبَّصُوا فَاِنّ۪ي مَعَكُمْ مِنَ الْمُتَرَبِّص۪ينَۜ ﴿٣١﴾ اَمْ تَأْمُرُهُمْ اَحْلَامُهُمْ بِهٰذَٓا اَمْ هُمْ قَوْمٌ طَاغُونَۚ ﴿٣٢﴾ اَمْ
يَقُولُونَ تَقَوَّلَهُۚ بَلْ لَا يُؤْمِنُونَۚ ﴿٣٣﴾ فَلْيَأْتُوا بِحَد۪يثٍ مِثْلِه۪ٓ اِنْ كَانُوا صَادِق۪ينَۜ ﴿٣٤﴾ اَمْ خُلِقُوا مِنْ غَيْرِ
شَيْءٍ اَمْ هُمُ الْخَالِقُونَۜ ﴿٣٥﴾ اَمْ خَلَقُوا السَّمٰوَاتِ وَالْاَرْضَۚ بَلْ لَا يُوقِنُونَۜ ﴿٣٦﴾ اَمْ عِنْدَهُمْ خَزَٓائِنُ
رَبِّكَ اَمْ هُمُ الْمُصَيْطِرُونَۜ ﴿٣٧﴾ اَمْ لَهُمْ سُلَّمٌ يَسْتَمِعُونَ ف۪يهِۚ فَلْيَأْتِ مُسْتَمِعُهُمْ بِسُلْطَانٍ مُب۪ينٍۜ ﴿٣٨﴾

---

**31) (قُلْ تَرَبَّصُوا فَاِنّ۪ي مَعَكُمْ مِنَ الْمُتَرَبِّص۪ينَ)** - (Ey Məhəmməd), **onlara de ki, gözləyin, mən də sizinlə birlikdə gözləyənlərdənəm. Görək axırımız necə olacaq? Mən sizə qalib olacam, yoxsa siz mənə qalib olacaqsınız?**

**32) (اَمْ تَأْمُرُهُمْ اَحْلَامُهُمْ بِهٰذَٓا اَمْ هُمْ قَوْمٌ طَاغُونَ) Qüreyş camaatının müdrikləri,** (hansı ki, özləri özlərinə ağıllı deyirlər), **artıq-əskik danışmağı əmr edib sənə kahin və şair, məcnun deyirlər? Ya da ki, asi və haqqı inkar edən inadçı şəxslərdirlər. İnadlarından belə sözlər söyləyirlər.**

**33) (اَمْ يَقُولُونَ تَقَوَّلَهُۚ بَلْ لَا يُؤْمِنُونَ) Yoxsa deyirlər ki,** (Məhəmməd) **Quranı özündən düzəldib? Yox, bu söz batildir. Əksinə, onlar iman etməyib, küfr və inadlarından belə deyirlər. Quranın müqabilində aciz olduqlarından bilirlər ki, Quranı sən** (Məhəmməd) **özündən düzəltməmisən. Sən bir ərəbsən. Əgər Quranı özündən düzəltmiş olsaydın, digər ərəblər də buna qadir olardılar.**

**34) (فَلْيَأْتُوا بِحَد۪يثٍ مِثْلِه۪ٓ اِنْ كَانُوا صَادِق۪ينَ) - Əgər doğru deyirlərsə ki, guya Quranı sən** (Məhəmməd) **özündən düzəldibsən, onlar da Quran kimi bir söz gətirsinlər. O vaxt məlum olar ki, Quranı sən** (Məhəmməd) **özündən düzəldibsən.**

**35) (اَمْ خُلِقُوا مِنْ غَيْرِ شَيْءٍ اَمْ هُمُ الْخَالِقُونَ) Yoxsa müşriklər elə güman edirlər ki, yaradıcısız dünyaya gəliblər? Yoxsa özləri özlərini yaradıb, bu səbəbdən aləmin yaradıcısına itaət etmirlər?**

**36) (اَمْ خَلَقُوا السَّمٰوَاتِ وَالْاَرْضَۚ بَلْ لَا يُوقِنُونَ) Yoxsa göyləri və yeri onlar yaradıblar? Yox, əgər onlardan soruşsan, deyərlər: “Allah-Təala yaradıbdır. Lakin dediklərinə tam inanmırlar, əgər tam inansaydılar, Allah-Təaladan başqasına ibadət etməzdilər.**

**37) (اَمْ عِنْدَهُمْ خَزَٓائِنُ رَبِّكَ اَمْ هُمُ الْمُصَيْطِرُونَ)** - (Ey Məhəmməd), **yoxsa sənin rəbbin Allah-Təalanın elm, hikmət xəzinələri onların yanındadır ki, öz istəkləri ilə kimi istəyirlər, peyğəmbər etsinlər, yoxsa onlar məhv edən və qalib olan sahibkardırlar ki, heç bir nəfərin əmr və qadağasına tabe olmurlar?**

**38) (اَمْ لَهُمْ سُلَّمٌ يَسْتَمِعُونَ ف۪يهِ) Yoxsa onların nərdivanı var ki, göyə çıxıb, vəhy olan kəlamları eşidirlər? (فَلْيَأْتِ مُسْتَمِعُهُمْ بِسُلْطَانٍ مُب۪ينٍ) - Əgər iddia edir-**

اَمْ لَهُ الْبَنَاتُ وَلَكُمُ الْبَنُونَ ﴿٣٩﴾ اَمْ تَسْئَلُهُمْ اَجْرًا فَهُمْ مِنْ مَغْرَمٍ مُثْقَلُونَ ﴿٤٠﴾ اَمْ عِنْدَهُمُ الْغَيْبُ
فَهُمْ يَكْتُبُونَ ﴿٤١﴾ اَمْ يُرِيدُونَ كَيْدًا فَالَّذِينَ كَفَرُوا هُمُ الْمَكِيدُونَ ﴿٤٢﴾ اَمْ لَهُمْ اِلٰهٌ غَيْرُ اللّٰهِ
سُبْحَانَ اللّٰهِ عَمَّا يُشْرِكُونَ ﴿٤٣﴾ وَاِنْ يَرَوْا كِسْفًا مِنَ السَّمَاۤءِ سَاقِطًا يَقُولُوا سَحَابٌ مَرْكُومٌ ﴿٤٤﴾

---

**lərsə, gərək** (vəhy) **eşidənləri iddialarına müvafiq açıq-aşkar dəlil gətirsinlər.**

**39) (اَمْ لَهُ الْبَنَاتُ وَلَكُمُ الْبَنُونَ) Yoxsa Allah-Təala üçün qızlar və sizin üçün** (Qüreyş camaatı) **oğlanlar vardır ki, deyirsiniz: "Mələklər Allah-Təalanın qızlarıdırlar?**

**40) (اَمْ تَسْئَلُهُمْ اَجْرًا فَهُمْ مِنْ مَغْرَمٍ مُثْقَلُونَ)** - (Ey Məhəmməd), **yoxsa onlardan peyğəmbərliyi təbliğ üçün bir əcr və muzd istəyirsən? Bəlkə o səbəbə görə ağır cərimə altında qaldıqları üçün sənə tabe olmurlar?**

**41) (اَمْ عِنْدَهُمُ الْغَيْبُ فَهُمْ يَكْتُبُونَ) Yoxsa onların yanında qeyb elmi vardır ki, onu yazıb deyirlər: "Biz yenidən həyat tapıb, məhşərə varid olmayacağıq, ya da ki, həyat olsa da bizə əzab edilməyəcək.**

**42) (اَمْ يُرِيدُونَ كَيْدًا فَالَّذِينَ كَفَرُوا هُمُ الْمَكِيدُونَ) Yoxsa məkr və hiylə edirlər ki,** (Ey Məhəmməd) **səni qətl etsinlər? O kafirlər ki, belə məkr və hiylə edirlər, onların özlərinə bu məkr, hiylələrinin günahının əzabı qayıdıb zəlil və məğlub olacaqlar. (Qüreyş camaatı Darün-Nədvədə (şura məclisində) cəm olub, Allahın Rəsulunu qətl etmək haqqında məşvərət etdilər. Allah-Təala onların bu əməllərini peyğəmbərə xəbər verdi. Onların məkr, hiylələri peyğəmbərə təsir etməyib, Allah-Təala müsəlmanları onlara hakim etdi. Bədir savaşında onların bəzisi öldürülüb, bəziləri əsir olub, zəlil oldular).**

**43) (اَمْ لَهُمْ اِلٰهٌ غَيْرُ اللّٰهِ سُبْحَانَ اللّٰهِ عَمَّا يُشْرِكُونَ)** - (Ey Məhəmməd), **yoxsa insanlardan ötrü Allah-Təaladan başqa bir haqq məbud vardır ki, Allah-Təalaya şərik qoşub, ibadət edirlər? Allah-Təalaya şərik qoşduqları məbudlardan o, pak və müqəddəsdir.**

**44) (وَاِنْ يَرَوْا كِسْفًا مِنَ السَّمَاۤءِ سَاقِطًا يَقُولُوا سَحَابٌ مَرْكُومٌ)** - (Ey Məhəmməd), **müşriklər sənə deyirlər: "Əgər sən doğru peyğəmbərsənsə, göydən bir parça yerə sal ki, səndən ötrü möcüzə olsun. Sənin də istəyin odur ki, bu iş vaqe olsun. Lakin belə iş vaqe olan deyildir. Əgər bir ehtimal, bu iş vaqe olub, müşriklər baxıb görsələr ki, göydən bir parça yerə düşdü, hər halda deyəcəklər ki, bunlar bir-birinin üstünə cəm olan buludlardır ki, yerə düşür və bu səbəbdən hikmətimiz belə işlərin tərki yönündədir.** (İlahi, sən belə buyurursan və lakin özlərini islam ümmətinə rəis sayanların əksəriyyəti sənin

فَذَرْهُمْ حَتّٰى يُلَاقُوا يَوْمَهُمُ الَّذ۪ي ف۪يهِ يُصْعَقُونَۙ ﴿٤٥﴾ يَوْمَ لَا يُغْن۪ي عَنْهُمْ كَيْدُهُمْ شَيْـًٔا وَلَا هُمْ
يُنْصَرُونَۜ ﴿٤٦﴾ وَاِنَّ لِلَّذ۪ينَ ظَلَمُوا عَذَابًا دُونَ ذٰلِكَ وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَعْلَمُونَ ﴿٤٧﴾ وَاصْبِرْ لِحُكْمِ
رَبِّكَ فَاِنَّكَ بِاَعْيُنِنَا وَسَبِّحْ بِحَمْدِ رَبِّكَ ح۪ينَ تَقُومُۙ ﴿٤٨﴾ وَمِنَ الَّيْلِ فَسَبِّحْهُ وَاِدْبَارَ النُّجُومِ ﴿٤٩﴾

---

sözünü yozub, başqa mənalar verib, Qurani-Şərifdə inkar olunan möcüzələrin hamısının və hətta daha çoxunun peyğəmbərdən meydana gəldiyini isbata çalışıb, o barədə kitablar yazıb, saysız-hesabsız möcüzələr yad ediblər. İlahi, Qurani-Şərifin nurunu kəşf edən şəxslər əgər mövcud isələr, onlara dost və yardımçı ol, əgər elə şəxslər yoxsa, onları qeybdən yarat. Ta ki, Qurani-Şərifin ehkamını dirildib, cəhələt əvəzinə elm yayılıb, nəcib islam ümməti əvvəlki şərəfli hallarına qayıtsınlar. Amin! Bu kitabı oxuyanlar da desinlər: “Amin!)

**45) (فَذَرْهُمْ حَتّٰى يُلَاقُوا يَوْمَهُمُ الَّذ۪ي ف۪يهِ يُصْعَقُونَ)** - (Ey Məhəmməd), **bu müşrikləri tərk edib, burax, qoy vəd edilən əcəlləri yetişib həlak olan günə qovuşana qədər öz hallarında qalsınlar.**

**46) (يَوْمَ لَا يُغْن۪ي عَنْهُمْ كَيْدُهُمْ شَيْـًٔا وَلَا هُمْ يُنْصَرُونَ) Həlak olan günləri o gündür ki, məkr, hiylələri o gün onlara heç bir fayda verməyib və bir nəfər kömək edən də tapılmayacaqdır ki, əzabı onlardan dəf etsin.**

**47) (وَاِنَّ لِلَّذ۪ينَ ظَلَمُوا عَذَابًا دُونَ ذٰلِكَ وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَعْلَمُونَ)** - (Ey Məhəmməd), **həqiqətən, xüsusilə bizim birliyimizi inkar edib, bizə şərik qoşan zalımlar və bütün digər zalımlardan ötrü qiyamət əzabından başqa dünyada da əzab vardır, lakin əzabın onlara göndərilməsinə agah deyildirlər.**

**48-49) (وَاصْبِرْ لِحُكْمِ رَبِّكَ فَاِنَّكَ بِاَعْيُنِنَا)** - (Ey Məhəmməd), **müşriklərə möhlət verməklə onların əziyyətlərinə və tənəli sözlərinə səbir et, həqiqətən, sən bizim gözümüzün önündəsən. Görürük, sənə necə əziyyət edirlər. Onlardan intiqam alacağıq.**

**(وَسَبِّحْ بِحَمْدِ رَبِّكَ ح۪ينَ تَقُومُۙ وَمِنَ الَّيْلِ فَسَبِّحْهُ وَاِدْبَارَ النُّجُومِ)** - (Ey Məhəmməd), **yuxudan duran zamanda və gecənin bəzi vaxtlarında və gecənin axırında ulduzlar geri qayıdıb, batan zamanda** (sübh vaxtında) **rəbbin Allah-Təalanı həmd-səna edərək onu zikr et.**

**Allaha həmd olsun, ət-Tur surəsinin təfsiri tamamlandı. Müşriklərin susdurulması üçün qüvvətli dəlil və sübutları ehtiva edən mübarək bir surədir. Allahın Rəsulu buyurdu: “Kim ət-Tur surəsini oxusa, Allah-Təalanın üzərinə haqdır ki, onu əzabdan qoruyub, cənnətdə nemət versin.**

## ən-NƏCM SURƏSİ

53-cü surədir. Məkkədə nazil olub, 61 ayə, 360 kəlmə və 1405 hərfdir.

وَالنَّجْمِ إِذَا هَوٰى ﴿١﴾ مَا ضَلَّ صَاحِبُكُمْ وَمَا غَوٰى ﴿٢﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (وَالنَّجْمِ إِذَا هَوٰى) And olsun səhər vaxtı batmaqda olan ulduzlara.**

**2) (مَا ضَلَّ صَاحِبُكُمْ وَمَا غَوٰى) Ey Qüreyş camaatı, sizin bu sahibiniz** (Məhəmməd) **nə zəlalətdə deyil, nə də asi və azğın olmayıb, əksinə doğruluq və hidayətdə olan bir peyğəmbərdir.**

**(*Qeyd:** *Urvə ibn Zübeyrdən rəvayət olunub, deyir ki, Allahın Rəsulunun bir qızı əmisi Əbu Ləhəbin oğlu Utbənin xanımı idi, elə ki, bu mübarək surə nazil oldu, Utbə atası Əbu Ləhəb ilə istədi Şama ticarətə getsin, dedi: "Gərək Məhəmmədin yanına gedib, ona bir qədər əziyyət edib, ondan sonra səfərə çıxam. Peyğəmbərin hüzuruna gedib dedi: "Ey Məhəmməd, mən "And olsun səhər vaxtı batmaqda olan ulduzlara" ayəsini inkar edirəm, ondan sonra o cənabın üzünə tüpürüb, qızını da boşadı.*

*Allahın Rəsulu bu hadisədən son dərəcə iyrənib, Utbəyə bəddua edib dedi: "Allahım! İtlərindən bir iti bu adama düçar elə!" Əbu Talib də həmin məclisdə idi. Peyğəmbərin bu qarğışından çəkinib dedi: "Qüreyş oğlu, gərək Utbə haqqında belə bəddua etməyəydin. Utbə oradan gedib, hadisəni atasına xəbər verdi. Ondan sonra Şam səfərinə getmək üçün Məkkədən çıxdılar. Yol əsnasında bir kilsənin yaxınlığında dayandılar. O kilsədən bir rahib çıxıb dedi: "Burada dayanıbsınız, amma bu yerdə yırtıcı heyvanlar çoxdur, ehtiyatlı olun."*

*Əbu Ləhəb bu sözü rahibdən eşidəndə peyğəmbərin oğluna etdiyi bəddua yadına düşdü. Dedi: "Ey Qüreyş camaatı, bu gecə bizə kömək edin, Məhəmmədin oğluma etdiyi bədduadan qorxuram, Qüreyş camaatı dəvələrini cəm edib, dairə formasında yatızdırıb, özləri də Utbəni ortaya salıb, gözlərini Utbəyə dikdilər. Gecədən bir qədər keçmiş yuxu onlara qalib gəldi. Bir şir gəlib, onların yanından keçib, Utbənin başını qoparıb, getdi. Camaat yuxudan oyananda Utbəni öldürülmüş gördülər. Ənsar şairlərindən Həssən ibn Sabit bir qəsidəsində bu əhvalata işarə edib deyir: "Aslan ovundan vaz keçmədi ki, yolçu da evinə geri dönsün".*

وَمَا يَنْطِقُ عَنِ الْهَوٰىۜ ﴿٣﴾ اِنْ هُوَ اِلَّا وَحْيٌ يُوحٰىۙ ﴿٤﴾ عَلَّمَهُ شَد۪يدُ الْقُوٰىۙ ﴿٥﴾ ذُو مِرَّةٍۜ فَاسْتَوٰىۙ
﴿٦﴾ وَهُوَ بِالْاُفُقِ الْاَعْلٰىۜ ﴿٧﴾ ثُمَّ دَنَا فَتَدَلّٰىۙ ﴿٨﴾ فَكَانَ قَابَ قَوْسَيْنِ اَوْ اَدْنٰىۚ ﴿٩﴾ فَاَوْحٰٓى اِلٰى
عَبْدِه۪ مَٓا اَوْحٰىۜ ﴿١٠﴾ مَا كَذَبَ الْفُؤَادُ مَا رَاٰى ﴿١١﴾ اَفَتُمَارُونَهُ عَلٰى مَا يَرٰى ﴿١٢﴾

---

**3-4) (وَمَا يَنْطِقُ عَنِ الْهَوٰىۜ اِنْ هُوَ اِلَّا وَحْيٌ يُوحٰىۙ) - Bu Quran ki,** (Məhəmməd) **onu sizə gətirib, öz istəyi ilə danışdığı sözlər deyildir. Əksinə, Allah-Təala tərəfindən vəhydir, ona vəhy olunur ki, sizə bildirsin.**

**5) (عَلَّمَهُ شَد۪يدُ الْقُوٰىۙ) Ruhani gücü son dərəcə çox olan Ruhül`əmin (Cəbrayıl) Quranı (Məhəmmədə) təlim edibdir.**

**6) (ذُو مِرَّةٍۜ فَاسْتَوٰىۙ)** (Cəbrayıl) **ağıl və iradə, qüvvət və kamal sahibi olub, ilahi əmrdə möhkəm və bərqərar durubdur.**

**7) (وَهُوَ بِالْاُفُقِ الْاَعْلٰى)** (Ruhani güc) **Ruhül`əmin ən uca üfüqdə, peyğəmbərdən çox uzaq bir dərəcədə idi.** (Ruhani güc elmi ilə peyğəmbər arasında son dərəcə uzaqlıq var idi).

**8) (ثُمَّ دَنَا فَتَدَلّٰىۙ) - Ondan sonra ruhani güc** (Cəbrayıl) **aşağı enib, peyğəmbərə yaxınlaşıb, onunla əlaqə qurdu.**

**9) (فَكَانَ قَابَ قَوْسَيْنِ اَوْ اَدْنٰىۚ) - Onun peyğəmbərə yaxınlığı iki yay miqdarı və ya ondan da yaxın idi.** (Ruhani güc peyğəmbərlə elə əlaqə qurdu ki, necə ki, yayın iki tərəfinin onları bir-birinə yaxınlaşdıran kiriş səbəbi ilə ayrılmaları imkansız olar və bu səbəbdən ruhani gücün peyğəmbərdən aralanması imkansız idi).

**10) (فَاَوْحٰٓى اِلٰى عَبْدِه۪ مَٓا اَوْحٰىۜ) Elə ki, Allah-Təala ruhani güclə** (Məhəmmədi) **qüvvətləndirdi, ondan sonra quluna** (Məhəmmədə) **nə ki, hökm edəcəkdi, vəhy göndərdi.** (Təfsirçilər Cəbrayılı hər bir şəklə girə bilən bir zat zənn edib, bu ayəni peyğəmbərin Cəbrayılla görüşməsi şəklində yozub, deyiblər: “İki dəfə Cəbrayılı əsl surətində gördü, biri yerdə, o birisi meraca gedərkən göydə. Digər vaxtlarda müxtəlif surətlərdə peyğəmbərə gələrdi. Əvvəl qeyd olunan ayələri peyğəmbərin Cəbrayılı yerdə görməsi şəklində yozub, növbəti ayələri Cəbrayılı göydə görməsi şəklində yozublar).

**11) (مَا كَذَبَ الْفُؤَادُ مَا رَاٰى)** (Məhəmmədin) **qəlbi görüb dərk etdiyi ilahi tövhidi təkzib etməyib, necə ki, bilib, dərk edib, o şəkildə də təsdiq edibdir.**

**12) (اَفَتُمَارُونَهُ عَلٰى مَا يَرٰى) Yoxsa siz müşriklər,** (Məhəmmədin) **görüb bildiyi iş** (tövhid) **barəsində onunla mübahisə edirsiniz? Cahilin alimlə mübahisə etməsi xətadır.**

وَلَقَدْ رَاٰهُ نَزْلَةً اُخْرٰىۙ ﴿١٣﴾ عِنْدَ سِدْرَةِ الْمُنْتَهٰى ﴿١٤﴾ عِنْدَهَا جَنَّةُ الْمَاْوٰىۜ ﴿١٥﴾ اِذْ يَغْشَى
السِّدْرَةَ مَا يَغْشٰىۙ ﴿١٦﴾ مَا زَاغَ الْبَصَرُ وَمَا طَغٰى ﴿١٧﴾

---

**13-14) (وَلَقَدْ رَاٰهُ نَزْلَةً اُخْرٰىۙ عِنْدَ سِدْرَةِ الْمُنْتَهٰى)** (Məhəmməd) **tövhidi qəlb gözü ilə görüb, tam inanıb, ondan aralanan deyildir. Bir dəfə də** (ilk dəfə peyğəmbərliklə məsul olan zamanda) **o tövhidə diqqət edib görmüşdü, lakin son dərəcə insanı heyrətləndirən bir məqamda görmüşdü, o zaman peyğəmbərliyinin əvvəli olduğuna görə** (Məhəmməddən) **ötrü həqiqət tam zahir olmadı. Lakin bu zamanda tövhid həqiqəti** (Məhəmmədə) **tam aydın olub ondan əsla aralanmaz. Siz müşriklər əbəs yerə onunla mübahisə etməyin.**

**15) (عِنْدَهَا جَنَّةُ الْمَاْوٰى) - Müttəqilərin qayıdacağı rahat olan cənnət həmin sonsuz uzaqlıqda ilk dəfə** (Məhəmməddən) **ötrü zahir olan şeyin** (tövhidin) **yanındadır.** (Yəni tövhidə bağlıdır).

**16) (اِذْ يَغْشَى السِّدْرَةَ مَا يَغْشٰىۙ)** (Məhəmməd) **o tövhid əmrini o zaman gördü ki, əzəmət və nuru tövhidi sonsuz dərəcədə əhatə edib, ondan ayrılan deyildi. Belə olan halda** (Məhəmmədi) **tövhiddən şirkə dəvət etmək olarmı? Necə ki, siz Qüreyş camaatı dəvət edirsiniz.**

**17) (مَا زَاغَ الْبَصَرُ وَمَا طَغٰى)** (Məhəmmədin) **gözü gördüyü tövhiddən nə yayınmayıb, nə də qamaşmadı, necə ki, görüb, o cür də həqiqəti üzrə inanıbdır.** (Təfsirçilər bu ayələri peyğəmbərin Cəbrayılı əsl surətində görməsi və göylərə merac etməsi şəklində yozublar. Ayələrin mənasını belə qeyd ediblər: "Allahın Rəsulu Cəbrayılı şərq tərəfində gördü, ondan sonra peyğəmbərə yaxınlaşdı və salladı. Peyğəmbərlə Cəbrayılın arasında iki yay qədər, hətta ondan da az bir məsafə var idi. Oradan Allah-Təalanın quluna (Məhəmmədə) vəhy etdi. Ondan sonra bir dəfə də Cəbrayılı əsl surətində merac vaxtı ərşdən yuxarıda, uca bir yerdə (Sədr) ağacının yanında gördü. O Sədr ağacının meyvəsinin böyüklüyü dağlar böyüklüyündə və yapraqları fil qulaqlarının böyüklüyündə idi. O ağacda saysız-hesabsız mələklər quş kimi cəm olub, Allah-Təalanın həmd-sənası ilə məşğul idilər və deyiblər ki, Cəbrayılın əsl surəti belədir: 700 qanadı vardır, peyğəmbərdən ötrü bir qanadını açdı, peyğəmbər onu görməyə dözməyib, yıxılıb bayıldı. Bu mənalara fikir verilib, diqqət edilsin, peyğəmbərin merac əhvalatı ixtilaflı bir məsələdir. Aişədən rəvayət edilibdir ki, Hz. Məhəmmədin bədəni mənim yanımdan heç ayrılmadı. Bununla belə meraca inananlar (Necə ki, "Xazin təfsiri"ndən, şeyx Mühyiddin ən-Nəvəvidən) nəql edib, ixtilaf ediblər ki, görəsən, Allahın Rəsulu merac gecəsində Allah-Təalanı gördü, yoxsa yox? İbrət alın, ey ağıl sahibləri, islam alimləri ömürlərini belə işlərə sərf etməklə məşğul olub, əsl mətləbdən qafil olduqları üçün islam ümməti belə rəzil və fəlakətli günlərə düçar olublar. Bizim bu zəmanəyə hərçənd islam və hidayətin yüksəlişi adı qoyulubsa da,

لَقَدْ رَاٰى مِنْ اٰيَاتِ رَبِّهِ الْكُبْرٰى ﴿١٨﴾ اَفَرَاَيْتُمُ اللَّاتَ وَالْعُزّٰىۙ ﴿١٩﴾ وَمَنٰوةَ الثَّالِثَةَ الْاُخْرٰى ﴿٢٠﴾
اَلَكُمُ الذَّكَرُ وَلَهُ الْاُنْثٰى ﴿٢١﴾ تِلْكَ اِذًا قِسْمَةٌ ضِيزٰى ﴿٢٢﴾ اِنْ هِيَ اِلَّا اَسْمَاۤءٌ سَمَّيْتُمُوهَاۤ اَنْتُمْ
وَاٰبَاۤؤُ۬كُمْ مَاۤ اَنْزَلَ اللّٰهُ بِهَا مِنْ سُلْطَانٍۜ اِنْ يَتَّبِعُونَ اِلَّا الظَّنَّ وَمَا تَهْوَى الْاَنْفُسُۚ وَلَقَدْ جَاۤءَهُمْ مِنْ رَبِّهِمُ
الْهُدٰىۜ ﴿٢٣﴾

---

əslində ona ilk ərəb cahiliyyəsindən betər cəhalət zəmanəsi demək doğrudur. Necə ki, hər bir ağıllı şəxsə gizli deyildir. Yardım və günahları bağışlamaq Allahdandır).

**18) (لَقَدْ رَاٰى مِنْ اٰيَاتِ رَبِّهِ الْكُبْرٰى) Həqiqətən,** (Məhəmməd) **rəbbi Allah-Təalanın tövhid və qüdrətinə işarə edən böyük ayə və sübutlarını görüb, tövhidə tam inandı.** (Bundan sonra qeyd olunan ayələr əvvəlki ayələrdə bizim qeyd etdiyimiz mənaların doğruluğuna kafi dəlildir).

**19) (اَفَرَاَيْتُمُ اللَّاتَ وَالْعُزّٰىۙ وَمَنٰوةَ الثَّالِثَةَ الْاُخْرٰى)** (Peyğəmbər deyir:) **ey Qüreyş camaatı, mənə xəbər verin görüm, bu bütlər ki, siz onlara sitayiş edirsiniz, əl-Lat, əl-Uzza və üçüncüsü Mənat, hansı ki, sizə görə Mənatın dərəcəsi əvvəlkilərdən azdır, yoxsa bunların bir qüdrəti varmı?**

**(*Qeyd:** *"Əl-Lat, əl-Uzza, Mənat üç bütün adıdır, bütpərəst ərəblər onlara ibadət edirdilər. Allahın Rəsulu Məkkəni fəth edəndən sonra onları məhv etməyi əmr etdi).*

**21) (اَلَكُمُ الذَّكَرُ وَلَهُ الْاُنْثٰى) - Bütlərə sitayiş etməklə yetinməyib, oğlanları özünüzə götürüb, qızları Allah-Təalaya isnad edib deyirsiniz: "Mələklər Allah-Təalanın qızlarıdırlar. Özünüzün qızı olanda rədd edib, ya da ki, qətl edirsiniz".**

**22) (تِلْكَ اِذًا قِسْمَةٌ ضِيزٰى) - Belə bölgü zalımların bölgüsüdür. Yaxşı bölüşdürmürsünüz.**

**23) (اِنْ هِيَ اِلَّا اَسْمَاۤءٌ سَمَّيْتُمُوهَاۤ اَنْتُمْ وَاٰبَاۤؤُ۬كُمْ مَاۤ اَنْزَلَ اللّٰهُ بِهَا مِنْ سُلْطَانٍۜ) - Bu bütlər ki, onlara sitayiş edirsiniz, həqiqətən, sadəcə adı olan şeylərdirlər ki, siz və ata-babalarınız onlara məbud deyib, ibadət edirsiniz. Allah-Təala onların məbud olması haqqında bir dəlil göndərməyibdir.**

**(اِنْ يَتَّبِعُونَ اِلَّا الظَّنَّ وَمَا تَهْوَى الْاَنْفُسُ)** - (Ey Məhəmməd), **müşriklər ancaq öz zənn və istəklərindən başqa dəlil və sübuta tabe olmayıb, bütlərə məbud deyirlər. (وَلَقَدْ جَاۤءَهُمْ مِنْ رَبِّهِمُ الْهُدٰىۜ) - Və halbuki rəbləri Allah-Təaladan onlara peyğəmbər** (Məhəmməd) **gəlib, kitab gətirib, onlardan ötrü bəyan edibdir ki, Allah-Təaladan başqa heç bir şeyə ibadət layiq deyildir. Bununla belə yenə bütlərə ibadət edirlər.**

اَمْ لِلْاِنْسَانِ مَا تَمَنّٰىۖ ﴿٢٤﴾ فَلِلّٰهِ الْاٰخِرَةُ وَالْاُولٰىۚ ﴿٢٥﴾ وَكَمْ مِنْ مَلَكٍ فِي السَّمٰوَاتِ لَا تُغْنِي
شَفَاعَتُهُمْ شَيْـًٔا اِلَّا مِنْ بَعْدِ اَنْ يَأْذَنَ اللّٰهُ لِمَنْ يَشَٓاءُ وَيَرْضٰى ﴿٢٦﴾ اِنَّ الَّذِينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِ
لَيُسَمُّونَ الْمَلٰٓئِكَةَ تَسْمِيَةَ الْاُنْثٰى ﴿٢٧﴾ وَمَا لَهُمْ بِهٖ مِنْ عِلْمٍۜ اِنْ يَتَّبِعُونَ اِلَّا الظَّنَّۚ وَاِنَّ الظَّنَّ لَا يُغْنِي
مِنَ الْحَقِّ شَيْـًٔاۚ﴿٢٨﴾

---

**24)** (اَمْ لِلْاِنْسَانِ مَا تَمَنّٰىۖ) - (Ey Məhəmməd), **Qüreyş camaatı qiyamət günündə bütlərin onlardan ötrü şəfaət etməsini arzu edirlər. Bəs insan hər bir şeyi ki, arzu etsə, arzusuna qovuşa bilərmi? Heyhat, Qüreyş öz arzularına çatmayıb, bütlər də onlardan ötrü şəfaət etməyə qabil deyildir.**

**25)** (فَلِلّٰهِ الْاٰخِرَةُ وَالْاُولٰىۚ) **- Dünya və axirət hər ikisi Allah-Təalaya məxsusdur. Allah-Təaladan izinsiz heç bir şəxs onlara sahib olmağa qadir deyildir.**

**26)** (وَكَمْ مِنْ مَلَكٍ فِي السَّمٰوَاتِ لَا تُغْنِي شَفَاعَتُهُمْ شَيْـًٔا اِلَّا مِنْ بَعْدِ اَنْ يَأْذَنَ اللّٰهُ لِمَنْ يَشَٓاءُ وَيَرْضٰى) **Göylərdə nə çox mələklər vardır ki, onların şəfaət etməsi heç bir şeyə fayda verməz. Ancaq Allah-Təalanın razı olub, istədiyi şəxsin şəfaət etməsi fayda verər.**

**27)** (اِنَّ الَّذِينَ لَا يُؤْمِنُونَ بِالْاٰخِرَةِ لَيُسَمُّونَ الْمَلٰٓئِكَةَ تَسْمِيَةَ الْاُنْثٰى) **Həqiqətən, o şəxslər ki, Allah-Təalaya iman etməyiblər, onlar mələklərə qadın adları qoyub deyirlər: "Mələklər Allah-Təalanın qızlarıdır."**

**28)** (وَمَا لَهُمْ بِهٖ مِنْ عِلْمٍۜ اِنْ يَتَّبِعُونَ اِلَّا الظَّنَّۚ وَاِنَّ الظَّنَّ لَا يُغْنِي مِنَ الْحَقِّ شَيْـًٔاۚ) **- Onların bu dedikləri sözlərinə dair** (mələklər Allah-Təalanın qızlarıdır) **bilgiləri yoxdur, bu sözdə zənnə tabe olub zənn və güman üzrə bir söz deyirlər. Həqiqətən, zənn insana haqdan heç* bir şeyi məlum etməz. Gərək hər bir şeydə elm sahibi olub, elmə tabe olmaq lazımdır, nəinki zənnə.**

**(*Qeyd:** *"Belə bir ayə Qurani-Kərimdə mövcud olduğu halda fəqihlər necə fətva verib deyirlər ki, "Elm qapısı bağlıdır", həmin bu sözün nəticəsi olaraq islam ümməti xüsusi və ya mütləq zənlə əməl edib, böyük cəhalətə düçar olublar. Bütün millətlər səy edib, elm axtarırlar, amma islam ümməti özlərini cəhalətə salıb, agah olduqları əmrləri də yox sayıb, hər bir hökmü zənn və güman üzrə etməyi özlərinə şüar ediblər və bu səbəbdən Allah-Təalanın kitabı Qurani-Şərifin müqabilində "xəbəri-vahid"ə yapışıb, Quranın hökmlərini hökmsüz, məhdudlanmış elan ediblər və bundan başqa Quranın öz mənasına olan işarəsini də zənn sayıblar, buna əsasən hər bir danışanın məqsədini bildirən sözünü də gərək zənnə yozub, heç bir şəxsdən ötrü elm hasil olmasın. Məsələn, bir şəxs xidmətçisinə əmr edib deyəndə ki, mənim libasımı gətir, xidmətçi də desə ki, bəlkə də ağanın məqsədi libası istəmək deyil və bu səbəbdən mənə libası aparmaq lazım deyildir. Çünki libası indi istəməsi zənnə dayanır və qəti deyildir. Xidmətçi belə xəyal edib, libası aparmayıb, yıxılıb yatsa, belə olan halda sahibi onunla necə rəftar edəcəksə,*

فَاَعْرِضْ عَنْ مَنْ تَوَلّٰى عَنْ ذِكْرِنَا وَلَمْ يُرِدْ اِلَّا الْحَيٰوةَ الدُّنْيَاۜ ﴿٢٩﴾ ذٰلِكَ مَبْلَغُهُمْ مِنَ الْعِلْمِۜ اِنَّ
رَبَّكَ هُوَ اَعْلَمُ بِمَنْ ضَلَّ عَنْ سَبِيلِهٖ وَهُوَ اَعْلَمُ بِمَنِ اهْتَدٰى ﴿٣٠﴾ وَلِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي
الْاَرْضِۙ لِيَجْزِيَ الَّذِينَ اَسَٓاؤُ۫ا بِمَا عَمِلُوا وَيَجْزِيَ الَّذِينَ اَحْسَنُوا بِالْحُسْنٰىۚ ﴿٣١﴾ اَلَّذِينَ يَجْتَنِبُونَ
كَبَٓائِرَ الْاِثْمِ وَالْفَوَاحِشَ اِلَّا اللَّمَمَۜ اِنَّ رَبَّكَ وَاسِعُ الْمَغْفِرَةِۜ هُوَ اَعْلَمُ بِكُمْ اِذْ اَنْشَاَكُمْ مِنَ الْاَرْضِ
وَاِذْ اَنْتُمْ اَجِنَّةٌ فِي بُطُونِ اُمَّهَاتِكُمْۚ فَلَا تُزَكُّٓوا اَنْفُسَكُمْۜ هُوَ اَعْلَمُ بِمَنِ اتَّقٰىۚ ﴿٣٢﴾

---

*Allah-Təala da bizimlə elə rəftar edəcəkdir. Əgər bütün sözlər zənn şəklində yozulsa, dünyanın bütün işləri tökülüb qalar, əmr və qadağa edənlərin sözünə əməl edilməz. Bəli, islam dini də bu şəkildə xəyallarla doldurulub, viran oldu).*

**29) (فَاَعْرِضْ عَنْ مَنْ تَوَلّٰى عَنْ ذِكْرِنَا وَلَمْ يُرِدْ اِلَّا الْحَيٰوةَ الدُّنْيَاۜ) -** (Ey Məhəmməd), **o şəxs ki, dünya həyatını istəyib, bizi zikr edib, yad etməkdən üz çevirib, bizi unutsa, elə şəxsi dəvət etməkdən üz döndər, onu dəvət etmək fayda verməyəcəkdir.**

**30) (ذٰلِكَ مَبْلَغُهُمْ مِنَ الْعِلْمِۜ) - Müşriklərin əməllərinin sonu budur ki, dünyanı axirətə üstün sayıb, bizə şirk qoşub, bizim zikrimizi tərk ediblər.**

**(اِنَّ رَبَّكَ هُوَ اَعْلَمُ بِمَنْ ضَلَّ عَنْ سَبِيلِهٖ وَهُوَ اَعْلَمُ بِمَنِ اهْتَدٰى) Həqiqətən, sənin rəbbin Allah-Təala onun yolundan zəlalətə düşənlərə və hidayət tapan şəxslərə agahdır.**

**31) (وَلِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۙ) Göylərdə və yerdə olan hər bir şeyin hakimiyyəti Allah-Təalaya məxsusdur.**

**(لِيَجْزِيَ الَّذِينَ اَسَٓاؤُ۫ا بِمَا عَمِلُوا وَيَجْزِيَ الَّذِينَ اَحْسَنُوا بِالْحُسْنٰىۚ) Allah-Təala göyləri və yeri yaradıb, bu aləmi tərtib etdi ki, pis əməl sahiblərinə pis cəza və yaxşı əməl sahiblərinin əməllərinə də yaxşı mükafat versin.**

**32) (اَلَّذِينَ يَجْتَنِبُونَ كَبَٓائِرَ الْاِثْمِ وَالْفَوَاحِشَ اِلَّا اللَّمَمَۜ اِنَّ رَبَّكَ وَاسِعُ الْمَغْفِرَةِ) - O şəxslər ki, etdikləri kiçik günahların xaricindəki böyük günahları və nəhayət çirkin işləri çəkinib tərk etsə, belə olan halda həqiqətən,** (Ey Məhəmməd), **sənin rəbbin Allah-Təalanın əfvi genişdir. Belə şəxsləri bağışlayar.**

**(هُوَ اَعْلَمُ بِكُمْ اِذْ اَنْشَاَكُمْ مِنَ الْاَرْضِ وَاِذْ اَنْتُمْ اَجِنَّةٌ فِي بُطُونِ اُمَّهَاتِكُمْۚ) - O zaman ki, sizi** (əcdadınız olan Adəmi) **Allah-Təala yerdən çıxarıb yaratdı və o zaman ki, sizlər gözləriniz bağlı olduğu halda analarınızın qarnında idiniz, Allah-Təala sizin hər bir əhvalınıza agah idi.**

**(فَلَا تُزَكُّٓوا اَنْفُسَكُمْ هُوَ اَعْلَمُ بِمَنِ اتَّقٰىۚ) Siz özünüz özünüzü tərifləyib, özünüzə yaxşı əməlləri isnad etməyin, tərif olunan şəxslər müttəqilərdir. Onlara da Allah-Təala agahdır. Lakin xeyir əməl edənlərin özlərini tərifləmələri xətadır. Ayə dünyada əməlləri ilə iftixar edən şəxslərin ümidlərini puç edir.**

اَفَرَاَيْتَ الَّذ۪ي تَوَلّٰىۙ ﴿٣٣﴾ وَاَعْطٰى قَل۪يلًا وَاَكْدٰى ﴿٣٤﴾ اَعِنْدَهُ عِلْمُ الْغَيْبِ فَهُوَ يَرٰى﴿٣٥﴾
اَمْ لَمْ يُنَبَّاْ بِمَا ف۪ي صُحُفِ مُوسٰىۙ﴿٣٦﴾ وَاِبْرٰه۪يمَ الَّذ۪ي وَفّٰىۙ ﴿٣٧﴾ اَلَّا تَزِرُ وَازِرَةٌ وِزْرَ اُخْرٰىۙ
﴿٣٨﴾ وَاَنْ لَيْسَ لِلْاِنْسَانِ اِلَّا مَا سَعٰىۙ ﴿٣٩﴾ وَاَنَّ سَعْيَهُ سَوْفَ يُرٰىۖ ﴿٤٠﴾ ثُمَّ يُجْزٰيهُ الْجَزَٓاءَ
الْاَوْفٰىۙ ﴿٤١﴾ وَاَنَّ اِلٰى رَبِّكَ الْمُنْتَهٰىۙ ﴿٤٢﴾ وَاَنَّهُ هُوَ اَضْحَكَ وَاَبْكٰىۙ ﴿٤٣﴾ وَاَنَّهُ هُوَ اَمَاتَ
وَاَحْيَاۙ ﴿٤٤﴾

---

**33-34) (اَفَرَاَيْتَ الَّذ۪ي تَوَلّٰىۙ وَاَعْطٰى قَل۪يلًا وَاَكْدٰى)** - (Ey Məhəmməd), **bəs görürsən o şəxsi ki, imana daxil olandan sonra üz döndərib çıxdı? Allah-Təala yolunda malından bir az sərf edib, ondan sonra arxasını kəsdi. Elə xəyal edir ki, ona əzab olunmaz.**

**35) (اَعِنْدَهُ عِلْمُ الْغَيْبِ فَهُوَ يَرٰى) - Bəlkə onun yanında qeyb elmi vardır ki, elm səbəbinə baxıb görür ki, ona əzab olunmayacaqdır?**

**36-37) (اَمْ لَمْ يُنَبَّاْ بِمَا ف۪ي صُحُفِ مُوسٰى وَاِبْرٰه۪يمَ الَّذ۪ي وَفّٰىۙ) Yoxsa bu şəxsə Musaya və həm də İbrahimə nazil olan səhifələrdə -** (hansı ki, İbrahim Allah-Təalanın hər bir əmrinə vəfa edib, onu yerinə yetirdi), **qeyd olunan hökmlər xəbər verilməyibdir? O hökmlər bundan sonra qeyd olunur.**

**38) (اَلَّا تَزِرُ وَازِرَةٌ وِزْرَ اُخْرٰىۙ) - O cümlədən o hökmlərdən biri budur ki, heç bir günahkar şəxs başqa günahkar şəxsin günahını öz üzərinə götürməyib, onun əvəzinə əzab olunmaz.**

**39) (وَاَنْ لَيْسَ لِلْاِنْسَانِ اِلَّا مَا سَعٰىۙ) - Və insandan ötrü ancaq özünün səy edib qazandığı xeyir və şərdən başqa heç bir şey yoxdur, o xeyir və ya şər dünya və axirətdə ona aid olar.** (Hər bir şeydə səy etmək lazımdır, köşədə əyləşib, hər bir işi Allah-Təalaya həvalə etmək tənbəllərin əməlidir).

**40) (وَاَنَّ سَعْيَهُ سَوْفَ يُرٰىۖ) - Və həqiqətən, insanın səy edib qazandığı əməlləri əlbəttə, qiyamət günündə görünəcəkdir.** (Hamıdan əvvəl özü görəcəkdir).

**41) (ثُمَّ يُجْزٰيهُ الْجَزَٓاءَ الْاَوْفٰىۙ) Hər bir insan öz əməlini görəndən sonra onun qarşılığı tam şəkildə ona verilər.**

**42) (وَاَنَّ اِلٰى رَبِّكَ الْمُنْتَهٰىۙ) - Və həqiqətən,** (Ey Məhəmməd) **bütün insanların qayıdacağı yer sənin rəbbin Allah-Təalanın tərəfinə olacaqdır.** (Bunların hamısı Musa və İbrahimin səhifələrində qeyd olunubdur).

**43) (وَاَنَّهُ هُوَ اَضْحَكَ وَاَبْكٰى) - Və həqiqətən, ağladıb güldürən Allah-Təaladır.** (Ağlamaq və gülmək səbəbini Allah-Təala yaradır).

**44) (وَاَنَّهُ هُوَ اَمَاتَ وَاَحْيَاۙ) - Və həqiqətən, öldürüb dirildən Allah-Təaladır.**

وَاَنَّهُ خَلَقَ الزَّوْجَيْنِ الذَّكَرَ وَالْاُنْثٰىۙ ﴿٤٥﴾ مِنْ نُطْفَةٍ اِذَا تُمْنٰىۖ ﴿٤٦﴾ وَاَنَّ عَلَيْهِ النَّشْاَةَ الْاُخْرٰىۙ ﴿٤٧﴾ وَاَنَّهُ هُوَ اَغْنٰى وَاَقْنٰىۙ ﴿٤٨﴾ وَاَنَّهُ هُوَ رَبُّ الشِّعْرٰىۙ ﴿٤٩﴾ وَاَنَّهُ اَهْلَكَ عَادًا الْاُولٰىۙ ﴿٥٠﴾ وَثَمُودَا۬ فَمَٓا اَبْقٰىۙ ﴿٥١﴾ وَقَوْمَ نُوحٍ مِنْ قَبْلُۜ اِنَّهُمْ كَانُوا هُمْ اَظْلَمَ وَاَطْغٰىۜ ﴿٥٢﴾ وَالْمُؤْتَفِكَةَ اَهْوٰىۙ ﴿٥٣﴾

---

**45) (وَاَنَّهُ خَلَقَ الزَّوْجَيْنِ الذَّكَرَ وَالْاُنْثٰىۙ) - Və həqiqətən, hər şeyi cüt-cüt, erkək və dişini yaradan Allah-Təaladır.**

**46) (مِنْ نُطْفَةٍ اِذَا تُمْنٰىۖ) Allah-Təala kişi və qadını ataların belindən çıxıb, anaların rəhmində yer tutan spermadan yaradır.**

**47) (وَاَنَّ عَلَيْهِ النَّشْاَةَ الْاُخْرٰىۙ) - Və həqiqətən, hükmət üzrə insanları yenidən yaradıb, məhşərə varid etmək Allah-Təalaya lazımdır ki, hər bir şəxsin əməlinin qarşılığını özünə versin.**

**48) (وَاَنَّهُ هُوَ اَغْنٰى وَاَقْنٰىۙ) - Və həqiqətən, ehtiyacsız edib çox mal verən və kifayət qədər sərmayə verən Allah-Təaladır.**

**49) (وَاَنَّهُ هُوَ رَبُّ الشِّعْرٰىۙ) - Və həqiqətən, Şir`a* ulduzunun rəbbi və yaradıcısı Allah-Təaladır.**

**(*Qeyd:** *Şir`a ulduzu "cövza"nın (ekizlər bürcünün) ardınca doğar. Şir`adan başqa ona "kəlbül-cəbbar" (qüdrətli köpək) adı da verilir. Şir`a ulduzı ikidir. Biri əl-Qumeysa, digəri əl-Uburdur. Burada məqsəd əl-Uburdur. Hansı ki, Xüzaə camaatı ona sitayiş edirdilər. Şir`aya sitayiş etməyi Xüzaə camaatının rəislərindən olan Əbu Kəbşə adlı bir şəxs başlatdı. Ərəblərin hamısı bütpərəst idilər. Həmin Əbu Kəbşə onlardan aralanıb, Şir`a ulduzuna sitayiş etdi. Qüreyş camaatı peyğəmbəri yeni din gətirməkdə Əbu Kəbşəyə oxşadıb, İbn Əbu Kəbşə (Əbu Kəbşənin oğlu) deyirdilər. Bir nəfər də Əbu Kəbşə adlı müsəlman bir şəxs islamı yaymaq üçün indi Çinin paytaxtı olan Pekin şəhrinə gedib, orada bir məscid tikdiribdir. Zəmanənin gərdişinə baxmayaraq, məscid hələ də durur. İslamı canlandıran belə şəxslərə sonsuz salam göndəririk. Allah onlardan razı olsun!)*

**50) (وَاَنَّهُ اَهْلَكَ عَادًا الْاُولٰىۙ) - Və həqiqətən, Allah-Təala öz qüdrəti ilə ona asi olan** (Hud) **peyğəmbərin qövmünü, əvvəlki Ad camaatını həlak etdi.**

**51) (وَثَمُودَا۬ فَمَٓا اَبْقٰىۙ) Salih peyğəmbərin qövmü Səmud camaatını** (ikinci Ad) **həlak edib, bir nəfər də onlardan sağ qoymadı.**

**52) (وَقَوْمَ نُوحٍ مِنْ قَبْلُۜ اِنَّهُمْ كَانُوا هُمْ اَظْلَمَ وَاَطْغٰىۜ) - Onlardan əvvəl Nuh qövmünü həlak etdi. Həqiqətən, onlar zülm və tüğyan etməkdə həddi aşmışdılar.**

**53) (وَالْمُؤْتَفِكَةَ اَهْوٰىۙ)** - (Ey Məhəmməd), (Mötəfikəni - Lut qövmünü) **zəlzələ səbəbinə Allah-Təala birdən göyə qaldırıb, yerə saldı.**

فَغَشّٰيهَا مَا غَشّٰىۚ ﴿٥٤﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكَ تَتَمَارٰى ﴿٥٥﴾ هٰذَا نَذٖيرٌ مِنَ النُّذُرِ الْاُو۫لٰى ﴿٥٦﴾
اَزِفَتِ الْاٰزِفَةُۚ ﴿٥٧﴾ لَيْسَ لَهَا مِنْ دُونِ اللّٰهِ كَاشِفَةٌ ﴿٥٨﴾ اَفَمِنْ هٰذَا الْحَدٖيثِ تَعْجَبُونَۙ ﴿٥٩﴾
وَتَضْحَكُونَ وَلَا تَبْكُونَۙ ﴿٦٠﴾ وَاَنْتُمْ سَامِدُونَ ﴿٦١﴾ فَاسْجُدُوا لِلّٰهِ وَاعْبُدُوا ﴿٦٢﴾

---

**54) (فَغَشّٰيهَا مَا غَشّٰىۚ) Sonsuz və böyük dərəcədə əzab onları tutdu.**

**55) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكَ تَتَمَارٰى) - Bəs ey insan, rəbbin Allah-Təalanın hansı nemətlərinə şəkk edirsən?** (Allah-Təalanın əzablarından ibrət almaq böyük nemət olduğundan əzabları da nemət adlandırdı).

**56) (هٰذَا نَذٖيرٌ مِنَ النُّذُرِ الْاُو۫لٰى) - Bu** (Məhəmməd) **əvvəlki peyğəmbərlər kimi olan bir peyğəmbərdir, necə ki, ondan əvvəl peyğəmbərlər gəliblər, bu da peyğəmbərdir. Sizə gəlibdir.**

**57) (اَزِفَتِ الْاٰزِفَةُ)** - (Ey Məhəmməd), **Qüreyş camaatına şiddətli əzabın gəlmə vaxtı** (Bədir savaşı) **yaxınlaşdı.**

**58) (لَيْسَ لَهَا مِنْ دُونِ اللّٰهِ كَاشِفَةٌ) - O şiddətli əzabı Allah-Təaladan başqa kəşf edib, dəf edən yoxdur.**

**59-60) (اَفَمِنْ هٰذَا الْحَدٖيثِ تَعْجَبُونَۙ وَتَضْحَكُونَ وَلَا تَبْكُونَ) - Bəs bu Qurani-Şərifə təəccüb və inkar edib, ona istehza ilə gülüb, ağlamırsınız? Və halbuki bizim əzabımızdan gərək qorxub, ağlayaydınız.**

**61) (وَاَنْتُمْ سَامِدُونَ) Ağlamaq əvəzinə təkəbbürlənib, Qurana qulaq asmayıb, mahnı oxumaqla məşğul olursunuz.**

**62) (فَاسْجُدُوا لِلّٰهِ وَاعْبُدُوا) - Belə çirkin işləri və bütlərə ibadət edib, səcdə etməyi tərk edib, Allah-Təalaya ibadət edib, səcdə edin.**

**Allaha həmd olsun, ən-Nəcm surəsinin təfsiri tamamlandı. Allah-Təalanın tövhidinə və kamil qüdrətinə işarə edən böyük ayələri ehtiva edən mübarək bir surədir. Əgər bu surədən başqa surələr olmasaydı da, hər halda aləmlərin yaradıcının tövhid və qüdrətinə və Hz. Məhəmmədin** (ə.s) **peyğəmbərliyinə dəlil olmaqda kifayət edərdi və halbuki Qurani-Şərifin hər bir surəsi və ayəsi bu mətləbə açıq-aşkar işarə edir.**

## əl-QƏMƏR SURƏSİ

54-cü surədir. Məkkədə nazil olub, 55 ayə, 342 kəlmə və 1423 hərfdir.

اِقْتَرَبَتِ السَّاعَةُ وَانْشَقَّ الْقَمَرُ ﴿١﴾ وَاِنْ يَرَوْا اٰيَةً يُعْرِضُوا وَيَقُولُوا سِحْرٌ مُسْتَمِرٌّ ﴿٢﴾ وَكَذَّبُوا وَاتَّبَعُوٓا اَهْوَآءَهُمْ وَكُلُّ اَمْرٍ مُسْتَقِرٌّ ﴿٣﴾

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (اِقْتَرَبَتِ السَّاعَةُ وَانْشَقَّ الْقَمَر) -** (Ey Məhəmməd), **qiyamət günü yaxınlaşır, o günün əlamətindən biri budur ki, ay* yarılıb parçalanar və məhv olar.**

**2) (وَاِنْ يَرَوْا اٰيَةً يُعْرِضُوا وَيَقُولُوا سِحْرٌ مُسْتَمِرٌّ) - Müşriklər qiyaməti inkar edib, qəbul etmirlər. Hərçənd hər bir dəlil və sübut qiyamətin olacağını xəbər verib, (Məhəmmədin) doğruluğunu göstərir. Bununla belə o dəlillərdən üz döndərib, deyirlər: "**(Məhəmmədin) **sözləri hamısı sehrdir. Ondan doğru söz çıxmaz.**

**3) (وَكَذَّبُوا وَاتَّبَعُوٓا اَهْوَآءَهُمْ وَكُلُّ اَمْرٍ مُسْتَقِر)** (Məhəmmədin) **dəlil və sübutlarını və Qurani-Şərifi təkzib edib, nəfsani arzularına tabe olmaqda sabit və bərqərar oldular. Lakin hər bir şey gərək öz qayəsinə və sonuna çatıb bərqərar olsun.** (Məhəmmədin) **işi də sonuna çatıb, haqq və ya batil olmağı aydın olacaqdır. O zaman ki, müşriklərə** (Məhəmmədin) **haqlılığı məlum olacaq, daha o vaxt onlara heç bir şey fayda verməyəcəkdir.**

**(*Qeyd:** *"Nəinki sadəcə ay, hətta aləmdə olan hər şey, hətta böyük parlaq nur olan günəş də parçalanıb məhv olar. Necə ki, digər ayələr də bu mətləbə işarə edir. Bizim bildiyimiz bu yer kürəsində yaşayan heyvanların müəyyən bir əcəli olduğu kimi, digər ulduzların və günəşin də müəyyən edilmiş bir əcəli vardır. Həmin müəyyən edilmiş əcəl yetişəndə hamısı məhv olarlar. Günəşin əbədi tutulması ilə nurlu aləm zülmətə bürünəcək və həmin müəyyən vaxtda qiyamət başlayacaq və Allah-Təala öz ali hikməti ilə o müəyyən edilmiş vaxtı cəza və haqq-hesab zamanı təyin edib. Qərb alimləri indi öz cüzi elmləri ilə yavaş-yavaş bu mətləbə agah olub, daha əvvəl Qurani-Şərifdə qeyd edilən ulduzların zaman içində məhv olacağı məsələsini dəlil və sübut üzrə indi müəyyən ediblər. Qurani-Şərif daha əvvəl nazil olub, indiyə kimi uca səslə xalqı bu elmlərə dəvət edir, amma xarici dillərdə elm öyrənən və özünü ali təhsilli sayan bəzi müsəlmanlar Qurani-Şərifdən və islam ehkamından qafil olduqları üçün sahib olduqları elm ilə iftixar edib, öz din və millətlərinə həqarətlə baxırlar. Qurani-Şərif kimi din və dünya işlərinə faydalı bir kitabdan bixəbər olub, digər millətlərdən öyrəndikləri elmlərlə fəxr edirlər. Belə olan halda müsəlmanların rəislərinin Qurani-Şərifin elm və ehka-*

وَلَقَدْ جَآءَهُمْ مِنَ الْاَنْبَآءِ مَا فٖيهِ مُزْدَجَرٌۙ ﴿٤﴾ حِكْمَةٌ بَالِغَةٌ فَمَا تُغْنِ النُّذُرُۙ ﴿٥﴾ فَتَوَلَّ عَنْهُمْۢ يَوْمَ
يَدْعُ الدَّاعِ اِلٰى شَيْءٍ نُكُرٍۙ ﴿٦﴾ خُشَّعًا اَبْصَارُهُمْ يَخْرُجُونَ مِنَ الْاَجْدَاثِ كَاَنَّهُمْ جَرَادٌ مُنْتَشِرٌۙ ﴿٧﴾
مُهْطِعٖينَ اِلَى الدَّاعِۜ يَقُولُ الْكَافِرُونَ هٰذَا يَوْمٌ عَسِرٌ ﴿٨﴾ كَذَّبَتْ قَبْلَهُمْ قَوْمُ نُوحٍ فَكَذَّبُوا عَبْدَنَا وَقَالُوا
مَجْنُونٌ وَازْدُجِرَ ﴿٩﴾ فَدَعَا رَبَّهُ اَنّٖي مَغْلُوبٌ فَانْتَصِرْ﴿١٠﴾

---

*mını müxtəlif dillərdə danışan müsəlman xalqlarına öyrətmələri ən vacib məsələ sayılmalıdır. İslam ümməti Qurani-Şərifə agah olmadıqları üçün hər cür fəlakət və rəzalətə düçar olublar).*

**4) (وَلَقَدْ جَآءَهُمْ مِنَ الْاَنْبَآءِ مَا فٖيهِ مُزْدَجَرٌ)** - (Ey Məhəmməd), **həqiqətən, həmin Qurani-Şərifdə əvvəlki ümmətlər haqqında müşriklərə o qədər xəbər gəlibdir ki, əgər ibrət alsalar, o xəbərlərdə onları küfrdən imana döndərməyə kifayət edəcək qədər dəlil və sübut vardır. Lakin bəsirətləri kor olub dəlil və sübutu dərk etmirlər.**

**5) (حِكْمَةٌ بَالِغَةٌ فَمَا تُغْنِ النُّذُرُ) Qurani-Şərifdə qeyd olunan xəbərlər ən yüksək haqqa qovuşmuş hikmətdir.** (Ey Məhəmməd), **elə ki, hikməti ehtiva edən sözləri müşriklər səndən qəbul etməyib, təkzib etdilər, daha sənin onları qorxutman müşriklərə heç bir fayda verməz və onları Allah-Təaladan ehtiyacsız etməz.**

**6) (فَتَوَلَّ عَنْهُمْۢ يَوْمَ يَدْعُ الدَّاعِ اِلٰى شَيْءٍ نُكُرٍۙ)** - (Ey Məhəmməd), **elə ki, müşriklərə dəvətinin təsir etmədiyinə agah oldun, onlardan üz döndərib, daha onları dəvət etmə. Onların o pis hallarını yadına sal ki, o gün bizim tərəfimizdən bir dəvətçi pis və iyrənc olan şeylərin** (əzabın) **tərəfinə onları dəvət edər.**

**7) (خُشَّعًا اَبْصَارُهُمْ يَخْرُجُونَ مِنَ الْاَجْدَاثِ كَاَنَّهُمْ جَرَادٌ مُنْتَشِرٌ) Gözlərində zillət əlaməti olduğu halda yer üzünə dağılan çəyirtkə kimi qəbirdən çıxarlar.**

**8) (مُهْطِعٖينَ اِلَى الدَّاعِۜ يَقُولُ الْكَافِرُونَ هٰذَا يَوْمٌ عَسِرٌ) Hamısı boyunlarını uzadıb, sürətlə dəvət edənin tərəfinə gedərlər. O vaxt kafirlər əzabı düşünüb deyərlər: "Bu gün nə çətin bir gündür.**

**9) (كَذَّبَتْ قَبْلَهُمْ قَوْمُ نُوحٍ فَكَذَّبُوا عَبْدَنَا وَقَالُوا مَجْنُونٌ وَازْدُجِرَ)** - (Ey Məhəmməd), **bu Qüreyşli Məkkə əhlindən əvvəlki dövrdə də** (Nuh) **peyğəmbərin qövmü öz peyğəmbərini təkzib etdi. Ondan sonra bizim qulumuzu** (Nuhu) **da təkzib edib, ona dəli adı qoyub, çirkin sözlər deyib, özlərindən uzaqlaşdırdılar.**

**10) (فَدَعَا رَبَّهُ اَنّٖي مَغْلُوبٌ فَانْتَصِرْ) Elə ki** (Nuha) **əziyyət etmədə həddi aşdılar,** (Nuh) **öz rəbbi Allah-Təalaya dua edib dedi: "Ey mənim rəbbim, həqiqətən, mən məğlub oldum. Müşriklərdən intiqam alıb, onlara əzab göndər".**

فَفَتَحْنَٓا اَبْوَابَ السَّمَٓاءِ بِمَٓاءٍ مُنْهَمِرٍۘ ﴿١١﴾ وَفَجَّرْنَا الْاَرْضَ عُيُونًا فَالْتَقَى الْمَٓاءُ عَلٰٓى اَمْرٍ قَدْ قُدِرَۚ ﴿١٢﴾ وَحَمَلْنَاهُ عَلٰى ذَاتِ اَلْوَاحٍ وَدُسُرٍۙ ﴿١٣﴾ تَجْر۪ي بِاَعْيُنِنَاۚ جَزَٓاءً لِمَنْ كَانَ كُفِرَ ﴿١٤﴾ وَلَقَدْ تَرَكْنَاهَٓا اٰيَةً فَهَلْ مِنْ مُدَّكِرٍ ﴿١٥﴾ فَكَيْفَ كَانَ عَذَاب۪ي وَنُذُرِ ﴿١٦﴾ وَلَقَدْ يَسَّرْنَا الْقُرْاٰنَ لِلذِّكْرِ فَهَلْ مِنْ مُدَّكِرٍ ﴿١٧﴾

---

**11)** (فَفَتَحْنَٓا اَبْوَابَ السَّمَٓاءِ بِمَٓاءٍ مُنْهَمِرٍۘ) (Nuhun) **duasını qəbul edib, sonu olmayan su ilə göyün qapılarını açıb, yer üzünə çoxlu su göndərdik.**

**12)** (وَفَجَّرْنَا الْاَرْضَ عُيُونًا فَالْتَقَى الْمَٓاءُ عَلٰٓى اَمْرٍ قَدْ قُدِرَ) - (Ey Məhəmməd), **yeri parçalayıb, çeşmələr çıxardıq.** (Sanki yer üzü tamamilə çeşmə oldu). **Göyün və yerin suları Allah-Təalanın təqdir etdiyi kimi bir-birinə qarışıb qovuşdular. Yer üzünü** (Nuh qövmünə məxsus olan yeri) **su basdı.**

**13)** (وَحَمَلْنَاهُ عَلٰى ذَاتِ اَلْوَاحٍ وَدُسُرٍۙ) **Nuhun qövmü suya qərq oldu, Nuhu taxta və mismarlardan düzəldilmiş gəmiyə mindirib, nicat verdik.**

**14)** (تَجْر۪ي بِاَعْيُنِنَاۚ جَزَٓاءً لِمَنْ كَانَ كُفِرَ) **- Digər peyğəmbərlərə bizim tərəfimizdən nemət verildiyi kimi, Nuha da mükafat olaraq, gəmi bizim nəzarətimizdə axıb gedirdi, onu inkar edib, təkzib edənlərə də təkzibləri səbəbi ilə (suda) qərq olma cəzası verildi.**

**15)** (وَلَقَدْ تَرَكْنَاهَٓا اٰيَةً فَهَلْ مِنْ مُدَّكِرٍ) - (Ey Məhəmməd), **həqiqətən,** (Nuh) **qövmünə göndərdiyimiz əzabı onlardan sonra gələnlərdən ötrü bizim tövhid və qüdrətimizə işarə edən dəlil təyin etdik. Bəs agah olub, ibrət alan varmı?**

**16)** (فَكَيْفَ كَانَ عَذَاب۪ي وَنُذُرِ) - (Ey Məhəmməd), **bəs mənim qorxutmağım, ondan sonra onu qəbul etməyənlərə əzab etməyim necə oldu?**

**17)** (وَلَقَدْ يَسَّرْنَا الْقُرْاٰنَ لِلذِّكْرِ فَهَلْ مِنْ مُدَّكِرٍ) - (Ey Məhəmməd), **həqiqətən, biz Quranı vəz kimi qəbul edib, ibrət alanlardan ötrü asan etdik, ta ki, ibrət alsınlar, bəs agah* olub, ibrət alan varmı?**

**(*Qeyd:** *"İlahi, ibrət alan hanı? Əgər ibrət alanlar olsaydı, Quranın tabe olunması vacib olan ehkamı gizli qalıb, islam ümməti belə qara günlərə düçar olmazdılar. İlahi, sən buyurursan ki, Quranı asan etdim ki, nəsihət verən hər bir ehkamından faydalansınlar. Lakin bizim öz rəislərimiz var ki, gərək sənin sözlərini onların rəyinə uyğunlaşdırıb, onların əmrinə əməl edək. Onlarsız sənin fərmanına əməl edə bilmərik. Görək bu barədə nə buyururlar? Onlar bizə buyururlar ki, siz Quranı bilmirsiniz və heç kimsə də bilə bilməz. Çox çətindir. Quranı bilmək olmaz və onun ayəsinin mənası tamam başqa şeydir. Sizin Quranın ayələrində nə işiniz vardır? Qurandan heç bir şey anlaya bilməzsiniz, Biz sizdən ötrü əsas qayda-qanunları - üsul-əsl, bəraət, "istishab" (daha əvvəl var olan bir şeyin hələ də var olmasının zənn edilməsi), "isaleyi-ədəm" (yoxluğun var olması qanunu) və*

كَذَّبَتْ عَادٌ فَكَيْفَ كَانَ عَذَابِي وَنُذُرِ ﴿١٨﴾ اِنَّآ اَرْسَلْنَا عَلَيْهِمْ رِيحًا صَرْصَرًا فِي يَوْمِ نَحْسٍ مُسْتَمِرٍّ
﴿١٩﴾ تَنْزِعُ النَّاسَ كَاَنَّهُمْ اَعْجَازُ نَخْلٍ مُنْقَعِرٍ ﴿٢٠﴾ فَكَيْفَ كَانَ عَذَابِي وَنُذُرِ ﴿٢١﴾ وَلَقَدْ يَسَّرْنَا
الْقُرْاٰنَ لِلذِّكْرِ فَهَلْ مِنْ مُدَّكِرٍ ﴿٢٢﴾ كَذَّبَتْ ثَمُودُ بِالنُّذُرِ ﴿٢٣﴾

---

*başqalarını hazırlayıb, həm də "xəbəri-vahid"lə (hansı ki, əksəriyyəti uydurmadır) ehkam düzəldib kitablar yazmışıq, siz onlara müraciət edin. Quranı ancaq imamlar bilər, onlar da ki, dünyada mövcud deyildirlər. Quran ancaq örtü içində qalmalıdır. İlahi, rəislər belə deyirlər, bizə də rəislərin sözləri sərf edir, onların sözlərini qoyub, sənin fərmanını qəbul etmək bizə çox çətindir və bu səbəbdən onların sözlərini qəbul, sənin ehkamını tərk edib, atmışıq. Ey müsəlmanlar, bir göz açıb, diqqətlə baxıb, Allahın ayələrini təfəkkür edin. Özünüzü zəlalətə salmayın. Qurana zidd fətva verənlərin rəyinə tabe olmayın, nə vaxta kimi zəlalətdə qalıb, onlar sizi öz istəklərinə uyğun heyvan kimi işlədəcəklər? Hər bir əməlləri Qurana müxalif olanların çirkin əməllərini Qurani-Şərif ortaya çıxartdığı üçün onlar sizi Qurandan uzaqlaşdırıb, cəhalətdə saxlayırlar. Onlardan çəkinib, qaçıb Qurana tabe olun. Peyğəmbər üçün açıq-aşkar təbliğdən başqa bir şey yoxdur).*

**18) (كَذَّبَتْ عَادٌ فَكَيْفَ كَانَ عَذَابِي وَنُذُرِ)** - (Ey Məhəmməd), **Ad camaatı Hud peyğəmbəri təkzib etdilər, bəs onları** (Hud) **vasitəsi ilə qorxutmağım, ondan sonra da qəbul etməyənlərə əzab etməyim necə oldu?**

**19) (اِنَّآ اَرْسَلْنَا عَلَيْهِمْ رِيحًا صَرْصَرًا فِي يَوْمِ نَحْسٍ مُسْتَمِرٍّ) Həqiqətən, biz bir nəhs gündə** (əzab günündə) **Ad camaatına şiddətli səslə hərəkət edən elə bir külək göndərdik ki, o günün əzabı** (8 gün) **davam edib, onları həlak etdi.**

**20) (تَنْزِعُ النَّاسَ كَاَنَّهُمْ اَعْجَازُ نَخْلٍ مُنْقَعِرٍ) - O külək elə şiddətli bir külək idi ki, kökündən qoparılan xurma ağacının kötüyü kimi insanları yerə çırpıb həlak edirdi.** (Ad camaatına gələn külək elə ki, onların evlərini yıxıb, daha onlardan ötrü evlərdə oturmaq mümkün olmadı, əl-ələ verib, səf-səf durub, küləyin qabağında dayanmaq istədilər. Külək onları götürüb, yerə çırpıb həlak etdi).

**21) (فَكَيْفَ كَانَ عَذَابِي وَنُذُرِ)** - (Ey Məhəmməd), **Ad camaatını qorxutmağım, ondan sonra da qəbul etməyənlərə əzab etməyim necə oldu?**

**22) (وَلَقَدْ يَسَّرْنَا الْقُرْاٰنَ لِلذِّكْرِ فَهَلْ مِنْ مُدَّكِرٍ)** - (Ey Məhəmməd), **həqiqətən, biz Quranı vəz kimi qəbul edib, ibrət alanlardan ötrü asan etdik. Ta ki, ibrət alsınlar. Bəs agah olub, ibrət alan varmı?**

**23) (كَذَّبَتْ ثَمُودُ بِالنُّذُرِ) Səmud camaatı Salehin xəbərdarlıqlarını** (Allah-Təalanın əzabı ilə qorxutmağını) **təkzib etdilər.**

فَقَالُوٓا اَبَشَرًا مِنَّا وَاحِدًا نَتَّبِعُهُ ۙ اِنَّآ اِذًا لَفِي ضَلَالٍ وَسُعُرٍ ﴿٢٤﴾ ءَاُلْقِيَ الذِّكْرُ عَلَيْهِ مِنْ بَيْنِنَا بَلْ هُوَ كَذَّابٌ اَشِرٌ﴿٢٥﴾ سَيَعْلَمُونَ غَدًا مَنِ الْكَذَّابُ الْاَشِرُ﴿٢٦﴾ اِنَّا مُرْسِلُوا النَّاقَةِ فِتْنَةً لَهُمْ فَارْتَقِبْهُمْ وَاصْطَبِرْ ۠ ﴿٢٧﴾ وَنَبِّئْهُمْ اَنَّ الْمَآءَ قِسْمَةٌ بَيْنَهُمْ ۚ كُلُّ شِرْبٍ مُحْتَضَرٌ ﴿٢٨﴾ فَنَادَوْا صَاحِبَهُمْ فَتَعَاطٰى فَعَقَرَ ﴿٢٩﴾ فَكَيْفَ كَانَ عَذَابِي وَنُذُرِ ﴿٣٠﴾ اِنَّآ اَرْسَلْنَا عَلَيْهِمْ صَيْحَةً وَاحِدَةً فَكَانُوا كَهَشِيمِ الْمُحْتَظِرِ ﴿٣١﴾

---

**24) (فَقَالُوٓا اَبَشَرًا مِنَّا وَاحِدًا نَتَّبِعُهُ ۙ اِنَّآ اِذًا لَفِي ضَلَالٍ وَسُعُرٍ) - Dedilər: "Bəs biz özümüzdən olan bir nəfər insana** (Salehə) **tabe olaq? Əgər tabe olsaq, həqiqətən, o zaman zəlalətdə və od içində olarıq.**

**25) (ءَاُلْقِيَ الذِّكْرُ عَلَيْهِ مِنْ بَيْنِنَا بَلْ هُوَ كَذَّابٌ اَشِرٌ) - Bəs necə oldu ki, bizim aramızdan Salehə vəhy nazil oldu? Və halbuki bizim içimizdə peyğəmbərliyə ondan da layiq şəxslər vardır, ona vəhy nazil olmayıb, əksinə çox yalançı, tüğyan edən, təkəbbürlü bir şəxsdir, təkəbbür və azğınlıq onu peyğəmbərlik iddiasına vadar edibdir.**

**26) (سَيَعْلَمُونَ غَدًا مَنِ الْكَذَّابُ الْاَشِرُ) Salehə xitab edib dedik: "Ey Saleh, müşriklərin təkzib etməsindən məhzun və qəmgin olma.** (Əzab nazil olan gündə) **biləcəklər ki, çox yalançı, tüğyan edən təkəbbürlü kimdir, sənsən, ya onlardır?**

**27) (اِنَّا مُرْسِلُوا النَّاقَةِ فِتْنَةً لَهُمْ فَارْتَقِبْهُمْ وَاصْطَبِرْ) Ey Saleh, həqiqətən, müşrikləri imtahan etməkdən ötrü istədikləri kimi dəvəni onlara göndərəcəyəm. Sən onların əziyyətlərinə səbir edib, dəvəyə nə edəcəklərini gözlə.**

**28) (وَنَبِّئْهُمْ اَنَّ الْمَآءَ قِسْمَةٌ بَيْنَهُمْ ۚ كُلُّ شِرْبٍ مُحْتَضَرٌ)** (Ey Saleh), **müşriklərə xəbər ver ki, həqiqətən, su onlarla dəvənin arasında bölüşdürülüb, su bir gün onların, bir gün dəvənin gərək olsun. Dəvənin növbəsində, dəvəyə mane olmayıb, hər kəs öz növbəsində gərək suya hazır olsun.**

**29) (فَنَادَوْا صَاحِبَهُمْ فَتَعَاطٰى فَعَقَرَ) - Onlar itaət etməyib, dəvənin qətlini məşvərət etmək üçün yoldaşlarını** (Qudar ibn Salifi) **çağırdılar. Onunla məşvərət edib, dəvənin qətlinə təşəbbüs etdilər. Belə böyük bir işi etməyə cürət edib,** (Qudar ibn Salif) **dəvənin damarını kəsib qətl etdi.**

**30) (فَكَيْفَ كَانَ عَذَابِي وَنُذُرِ) -** (Ey Məhəmməd), **bax gör ki, Səmud camaatını qorxutmağım, ondan sonra onu qəbul etməyənlərə əzab etməyim necə oldu?**

**31) (اِنَّآ اَرْسَلْنَا عَلَيْهِمْ صَيْحَةً وَاحِدَةً فَكَانُوا كَهَشِيمِ الْمُحْتَظِرِ) -** (Ey Məhəmməd), **həqiqətən, biz onlara bircə şiddətli səs göndərdik, o səs səbəbi ilə heyvanların quru otlardan düzəldilən ağılları ayaqlayıb tapdalaması kimi** (Səmud) **camaatı da həlak olub, məhv oldular.**

وَلَقَدْ يَسَّرْنَا الْقُرْاٰنَ لِلذِّكْرِ فَهَلْ مِنْ مُدَّكِرٍ ﴿٣٢﴾ كَذَّبَتْ قَوْمُ لُوطٍ بِالنُّذُرِ ﴿٣٣﴾ اِنَّٓا اَرْسَلْنَا عَلَيْهِمْ
حَاصِبًا اِلَّٓا اٰلَ لُوطٍۜ نَجَّيْنَاهُمْ بِسَحَرٍۙ ﴿٣٤﴾ نِعْمَةً مِنْ عِنْدِنَاۜ كَذٰلِكَ نَجْزِي مَنْ شَكَرَ ﴿٣٥﴾ وَلَقَدْ
اَنْذَرَهُمْ بَطْشَتَنَا فَتَمَارَوْا بِالنُّذُرِ ﴿٣٦﴾ وَلَقَدْ رَاوَدُوهُ عَنْ ضَيْفِهٖ فَطَمَسْنَٓا اَعْيُنَهُمْ فَذُوقُوا عَذَابِي
وَنُذُرِ ﴿٣٧﴾ وَلَقَدْ صَبَّحَهُمْ بُكْرَةً عَذَابٌ مُسْتَقِرٌّۚ ﴿٣٨﴾ فَذُوقُوا عَذَابِي وَنُذُرِ ﴿٣٩﴾ وَلَقَدْ يَسَّرْنَا
الْقُرْاٰنَ لِلذِّكْرِ فَهَلْ مِنْ مُدَّكِرٍ ﴿٤٠﴾

---

**32) (وَلَقَدْ يَسَّرْنَا الْقُرْاٰنَ لِلذِّكْرِ فَهَلْ مِنْ مُدَّكِرٍ) -** (Ey Məhəmməd), **həqiqətən, biz Quranı vəz kimi qəbul edib, ibrət alanlardan ötrü asan etdik ki, ibrət alsınlar, bəs agah olub ibrət alan varmı?**

**33) (كَذَّبَتْ قَوْمُ لُوطٍ بِالنُّذُرِ)** (Lut) **qövmü Lutun təhdidlərini** (xəbərdarlıqlarını) **təkzib etdilər.**

**34) (اِنَّٓا اَرْسَلْنَا عَلَيْهِمْ حَاصِبًا اِلَّٓا اٰلَ لُوطٍۜ نَجَّيْنَاهُمْ بِسَحَرٍۙ) Lut qövmü bizə asi olandan sonra həqiqətən, biz onlara daş atan külək göndərdik. Daş onları əzib, ondan sonra zəlzələ ilə onları həlak etdik. Ancaq səhər camaat həlak olan vaxt Lutun ailəsinə** (xanımından başqa) **nicat verdik.**

**35) (نِعْمَةً مِنْ عِنْدِنَاۜ كَذٰلِكَ نَجْزِي مَنْ شَكَرَ) - Bizim tərəfimizdən Luta mükafat vermək üçün ona ailəsi ilə birlikdə nicat verdik.** (Ey Məhəmməd), **bizim nemətlərimizə şükür edənlərə belə mükafat verdik.**

**36) (وَلَقَدْ اَنْذَرَهُمْ بَطْشَتَنَا فَتَمَارَوْا بِالنُّذُرِ) -** (Ey Məhəmməd), **həqiqətən, Lut öz qövmünü bizim əzab etməmizlə qorxutdu, amma onlar Lutun qorxutmağına şəkk edib təkzib etdilər.**

**37) (وَلَقَدْ رَاوَدُوهُ عَنْ ضَيْفِهٖ) -** (Ey Məhəmməd), **Lutun qövmü elə xəbis camaat idi ki, Luta gələn qonaqları öz xəbis** (livata, mavilik) **əməlləri üçün istədilər. (فَطَمَسْنَٓا اَعْيُنَهُمْ فَذُوقُوا عَذَابِي وَنُذُرِ) - Onların bu əməllərinə görə onların gözlərini kor edib, gözlərinin yeri digər əzaları kimi olub, onlarda göz əlaməti qalmadı. Lutun dili ilə onlara dedik: "Bizim əzabımızı** (Lutun qorxutduğu əzabı) **dadın.**

**38) (وَلَقَدْ صَبَّحَهُمْ بُكْرَةً عَذَابٌ مُسْتَقِرٌّۚ) -** (Ey Məhəmməd), **həqiqətən, sübh vaxtı gələn əzab onları tutub, həlak oldular, axirət əzabına götürüldülər.**

**39) (فَذُوقُوا عَذَابِي وَنُذُرِ) - Onlara dedim: "Mənim əzabımı** (Lutun qorxutduğu əzabı) **dadın.** (Bu ayənin təkrar edilməsi onlara edilən əzabın şiddətini bəyan etmək üçündür).

**40) (وَلَقَدْ يَسَّرْنَا الْقُرْاٰنَ لِلذِّكْرِ فَهَلْ مِنْ مُدَّكِرٍ) -** (Ey Məhəmməd), **həqiqətən, biz Quranı vəz kimi qəbul edib, ibrət alanlardan ötrü asan etdik. Bəs ibrət alan varmı?** (Bu ayənin təkrarlanması Qurani-Şərifin öyüd-nəsihət verən eh-

وَلَقَدْ جَٓاءَ اٰلَ فِرْعَوْنَ النُّذُرُۚ ﴿٤١﴾ كَذَّبُوا بِاٰيَاتِنَا كُلِّهَا فَاَخَذْنَاهُمْ اَخْذَ عَزٖيزٍ مُقْتَدِرٍ ﴿٤٢﴾ اَكُفَّارُكُمْ
خَيْرٌ مِنْ اُو۬لٰٓئِكُمْ اَمْ لَكُمْ بَرَٓاءَةٌ فِي الزُّبُرِۚ ﴿٤٣﴾ اَمْ يَقُولُونَ نَحْنُ جَمٖيعٌ مُنْتَصِرٌ ﴿٤٤﴾ سَيُهْزَمُ الْجَمْعُ
وَيُوَلُّونَ الدُّبُرَ ﴿٤٥﴾ بَلِ السَّاعَةُ مَوْعِدُهُمْ وَالسَّاعَةُ اَدْهٰى وَاَمَرُّ ﴿٤٦﴾ اِنَّ الْمُجْرِمٖينَ فٖي ضَلَالٍ وَسُعُرٍۢ
﴿٤٧﴾ يَوْمَ يُسْحَبُونَ فِي النَّارِ عَلٰى وُجُوهِهِمْۜ ذُوقُوا مَسَّ سَقَرَ ﴿٤٨﴾ اِنَّا كُلَّ شَيْءٍ خَلَقْنَاهُ بِقَدَرٍ ﴿٤٩﴾

---

kamının asan anlaşıldığını bizə təkrar bildirmək üçündür. Kimsə deməsin ki, bizə çətin və ehkamı naməlum olan bir kitab gəlibdir).

**41) (وَلَقَدْ جَٓاءَ اٰلَ فِرْعَوْنَ النُّذُرُ)** - (Ey Məhəmməd), **həqiqətən, firon və ona tabe olanlara bizim tərəfimizdən** (Musa vasitəsi ilə) **qorxudan ayələr və sübutlar gəldi.**

**42) (كَذَّبُوا بِاٰيَاتِنَا كُلِّهَا فَاَخَذْنَاهُمْ اَخْذَ عَزٖيزٍ مُقْتَدِرٍ) - Bizim ayələrimizin hamısını təkzib etdilər. Hər bir şeyə qalib olub, iqtidar və qüdrət sahibi olan şəxsin yaxalaması kimi biz də onları əzabla yaxalayıb, həlak etdik.**

**43) (اَكُفَّارُكُمْ خَيْرٌ مِنْ اُو۬لٰٓئِكُمْ اَمْ لَكُمْ بَرَٓاءَةٌ فِي الزُّبُرِۚ) Ey Məkkə müşrikləri, siz ki, (Məhəmmədi) təkzib edirsiniz, bəs sizin kafirləriniz qeyd olunan Nuh, Ad, Səmud, Lut, firon qövmlərinin kafirlərindən yaxşıdırlar ki, sizə əzab edilməsin? Yoxsa sizdən ötrü əvvəlki kitablarda bəraət yazılıb ki, Allah-Təalanın əzabından aman içindəsiniz? Bunların heç biri ki. yoxdur, bəs niyə təkəbbür edirsiniz?**

**44) (اَمْ يَقُولُونَ نَحْنُ جَمٖيعٌ مُنْتَصِرٌ)** - (Ey Məhəmməd), **bəlkə bu Qüreyş camaatı deyirlər ki, biz qüvvətli və kömək edilən bir camaatıq, düşmənlərimizdən imtina edə bilərik, düşmənlər bizə zərər verə bilməzlər?**

**45) (سَيُهْزَمُ الْجَمْعُ وَيُوَلُّونَ الدُّبُرَ) - Əlbəttə, onların camaatları (Bədir günündə) dağılıb, arxa çevirib qaçacaqlar. (Bu ayə Məkkədə nazil olduğu üçün peyğəmbərə müjdədir).**

**46) (بَلِ السَّاعَةُ مَوْعِدُهُمْ وَالسَّاعَةُ اَدْهٰى وَاَمَرُّ) - Əksinə,** (Bədirdən sonra) **onlara vəd edilən əzab qiyamətdir, qiyamət gününün əzabı** (Bədir günündə öldürülməkdən və əsir olmaqdan) **şiddətli və daha acıdır.**

**47) (اِنَّ الْمُجْرِمٖينَ فٖي ضَلَالٍ وَسُعُرٍۢ)** - (Ey Məhəmməd), **həqiqətən, asi və günahkarlar dünyada zəlalətdə, axirətdə də cəhənnəm odunda olacaqlar.**

**48) (يَوْمَ يُسْحَبُونَ فِي النَّارِ عَلٰى وُجُوهِهِمْۜ ذُوقُوا مَسَّ سَقَرَ) - O gün ki** (qiyamət günü) **günahkarları cəhənnəm odunun içində üzüüstə sürüyüb, onlara deyilər: "Cəhənnəm odunun sizə toxunmasını hiss edib dadın.**

**49) (اِنَّا كُلَّ شَيْءٍ خَلَقْنَاهُ بِقَدَرٍ)** - (Ey Məhəmməd), **həqiqətən, biz hər bir şeyi hikmət üzrə təqdir və tərtib edib. yaratmışıq. Əbəs yerə və hikmətsiz yaratmamışıq.**

وَمَٓا اَمْرُنَٓا اِلَّا وَاحِدَةٌ كَلَمْحٍ بِالْبَصَرِ ﴿٥٠﴾ وَلَقَدْ اَهْلَكْنَٓا اَشْيَاعَكُمْ فَهَلْ مِنْ مُدَّكِرٍ ﴿٥١﴾ وَكُلُّ
شَيْءٍ فَعَلُوهُ فِي الزُّبُرِ ﴿٥٢﴾ وَكُلُّ صَغِيرٍ وَكَبِيرٍ مُسْتَطَرٌ ﴿٥٣﴾ اِنَّ الْمُتَّقِينَ فِي جَنَّاتٍ وَنَهَرٍۙ ﴿٥٤﴾
فِي مَقْعَدِ صِدْقٍ عِنْدَ مَلِيكٍ مُقْتَدِرٍ ﴿٥٥﴾

---

**50) (وَمَٓا اَمْرُنَٓا اِلَّا وَاحِدَةٌ كَلَمْحٍ بِالْبَصَرِ)** - (Ey Məhəmməd), **bizim varlığın yaranması üçün etdiyimiz əmrimiz bir anlıq gözlə işarə edilən kimi ancaq bir kəlmədən ibarətdir,** (məsələn, “kün” – “ol” sözü kimi.) **Elə ki, bir şeyin yaradılmasını istədik, o şey gecikmədən olar.** (“Ol!” kəlməsi bizim dərk etməyimizdən ötrüdür. Yoxsa yaratmaq üçün Allah-Təalaya kəlmə, ya başqa şey lazım deyildir. Hətta Allah-Təalanın iradəsi o şeyin yaradılması üçün kifayət edər).

**51) (وَلَقَدْ اَهْلَكْنَٓا اَشْيَاعَكُمْ فَهَلْ مِنْ مُدَّكِرٍ) Ey müşriklər, həqiqətən, sizdən əvvəlki ümmətlərdən sizin kimi küfr və nifaqda olanları həlak etdik. Bəs ibrət alan oldumu? Əgər olsaydı, siz kafir olmazdınız.**

**52) (وَكُلُّ شَيْءٍ فَعَلُوهُ فِي الزُّبُرِ) Sizin kimi olan kafirlər, hər bir əməl ki, ediblər, hamısı mühafizlərin dəftərlərində** (kitablarında) **qorunub. Habelə sizin əməlləriniz də qeyd olunubdur.**

**53) (وَكُلُّ صَغِيرٍ وَكَبِيرٍ مُسْتَطَرٌ) Hər bir kiçik və böyük əməllərin hamısı lövhiməhfuzda** (ilahi elmdə) **yazılıb, qeyd olunub, dəyişən deyil.**

**54-55) (اِنَّ الْمُتَّقِينَ فِي جَنَّاتٍ وَنَهَرٍۙ)** - (Ey Məhəmməd), **həqiqətən, müttəqilərin axirətdəki məqamları ağaclarının və qəsrlərinin altından çaylar axan bağlarda olacaqdır. (فِي مَقْعَدِ صِدْقٍ عِنْدَ مَلِيكٍ مُقْتَدِرٍ) Həmin bağlarda aciz olmayıb, hər bir şeyə malik olan Allah-Təalanın** (mənəvi) **yanında razı olduqları mənzil və məkanda olacaqlar.**

**Allaha həmd olsun, əl-Qəmər surəsinin təfsiri tamamlandı. Qorxutmağı və asanlaşdırmağı ehtiva edən mübarək bir surədir. Allah-Təalanın əzabından qorxanlardan ötrü kifayət edər. Allahın Rəsulu buyurdu: “Kim ki, əl-Qəmər surəsini bir gündən bir oxusa, Allah-Təala qiyamət günündə o şəxsi üzü on dörd gecəlik ay kimi olduğu halda məhşərə götürər.**

## ər-RƏHMAN SURƏSİ

55-ci surədir. Məkkədə nazil olub, 76 ayə, 351 kəlmə və 1636 hərfdir.

اَلرَّحْمٰنُۙ ﴿١﴾ عَلَّمَ الْقُرْاٰنَؕ ﴿٢﴾ خَلَقَ الْاِنْسَانَۙ ﴿٣﴾ عَلَّمَهُ الْبَيَانَ ﴿٤﴾ اَلشَّمْسُ وَالْقَمَرُ بِحُسْبَانٍۙ ﴿٥﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1-2) (اَلرَّحْمٰنُۙ عَلَّمَ الْقُرْاٰنَؕ) Rəhman olan Allah-Təala öz lütf və mərhəməti ilə Quranı göndərib sizə təlim etdi* ki, cəhalətdən xilas olub gözəl elm sahibi olasınız.**

**3) (خَلَقَ الْاِنْسَانَ عَلَّمَهُ الْبَيَانَ) - İnsanı yaradıb (nitqi) danışmağı ona öyrətdi ki, qəlbindəki mətləb və muradını asan şəkildə yerinə yetirsin.**

**(*Qeyd:** *"Allah-Təala bu surədə nemətlərini saymağa başlayıb, hamısından əvvəl nemətlərin ilki və ən fəzilətlisi olan elmi qeyd edib, arxasınca insanın həmin elmi ifadə etməsi üçün ona lazım olan nitqi bəyan edir, əgər o, elmdən başqa bir şey olsaydı, hər halda onu bəyan edərdi və bu səbəbdən o, Quranı təlim etməyə işarədir, həm də ki, Qurani-Şərif din və dünya işlərində kifayət edən bir kitabdır. Hər bir müsəlman üçün Quranın ehkamını, nəsihətlərini öyrənmək birinci dərəcəli vacib məsələdir. Lakin biz islam ümmətinin Qurani-Şərifin ehkamından xəbərimiz olmaya-olmaya adımızı Quran əhli qoymamız xətadır. "Elm öyrənmək kişi və qadın hər bir müsəlmana fərzdir" hədisinin məzmunu əvvəlcə Quran elminə, ondan sonra digər elmlərin öyrənilməsinə aiddir. Qurani-Şərif digər ilahi kitablar kimi deyildir. Onların bəzisi ancaq ehkama, bəziləri də ehkam və qaydalara aiddir. Lakin Qurani-Şərifin ayələrinin ehtiva etdiyi din və dünya işlərinə və ümmətin tərəqqisi yoluna işarə edən edən incəliklər həddən artıq çoxdur və bu səbəbdən Qurani-Şərif möcüzə olub, digər kitablar kimi deyil, əgər Quran əhli adlanan müsəlmanlar Qurani-Şərifin nuru ilə aydınlanıb, onun hər bir ehkamına əməl etməyi özlərinə lazım bilib, şüar etsələr, hər halda elm və mədəniyyətdə və gözəl əxlaq sahibi olmada məşhur və öncül olarlar. Necə ki, islamın ilk dövründə elə idilər. Alim şəxslərə hər bir şeydən vacib olan şey Qurani-Şərifin ehkamını insanlara öyrətməkdir. Nəinki onu Qurandan çəkindirib, uzaqlaşdırmaq. Necə ki, bu zamanda özlərini alim adlandıranların əksəriyyətinin adətləri bu cürdür. Allahım, onları doğru yola hidayət etdir və müvəffəq et!)*

**5) (اَلشَّمْسُ وَالْقَمَرُ بِحُسْبَانٍۙ) Günəş və ay Allah-Təalanın yanında hesabı məlum olan bir miqdar ilə hərəkət edib, onlardan insan nəslinə böyük faydalar gələr, məxluqatın məişəti üçün bir səbəbdirlər.**

وَالنَّجْمُ وَالشَّجَرُ يَسْجُدَانِ ﴿٦﴾ وَالسَّمَٓاءَ رَفَعَهَا وَوَضَعَ الْمِيزَانَۙ ﴿٧﴾ اَلَّا تَطْغَوْا فِي الْمِيزَانِ
﴿٨﴾ وَاَقِيمُوا الْوَزْنَ بِالْقِسْطِ وَلَا تُخْسِرُوا الْمِيزَانَ﴿٩﴾ وَالْاَرْضَ وَضَعَهَا لِلْاَنَامِۙ﴿١٠﴾ فِيهَا
فَاكِهَةٌ وَالنَّخْلُ ذَاتُ الْاَكْمَامِ﴿١١﴾ وَالْحَبُّ ذُو الْعَصْفِ وَالرَّيْحَانُۚ ﴿١٢﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا
تُكَذِّبَانِ﴿١٣﴾ خَلَقَ الْاِنْسَانَ مِنْ صَلْصَالٍ كَالْفَخَّارِۙ﴿١٤﴾

---

**6) (وَالنَّجْمُ وَالشَّجَرُ يَسْجُدَانِ) Yer üzündə bitən bütün otlar və ağaclar Allah-Təalaya səcdə edirlər.** (Hər bir ot və ağacın yaradılışının aləmin yaradıcısının tövhid və qüdrətinə işarə etməsi onun səcdə etməsi mənasındadır).

**7-8) (وَالسَّمَٓاءَ رَفَعَهَا وَوَضَعَ الْمِيزَانَ اَلَّا تَطْغَوْا فِي الْمِيزَانِ) Allah-Təala insan nəslinin yaşaması üçün ən vacib səbəb olan göyü ucaldıb, hər bir tərəfdən göy** (hava) **insanları əhatə edib, yaradılışları tamamlanarkən, ədalət ölçüsünü onların arasında yerləşdirdi və onlara peyğəmbərlərin vasitəsi ilə əmr etdi ki, siz insanlar əsla ədalət ölçüsünü pozmayıb, tüğyan etməyib, ədaləti tərk etməyin.**

**9) (وَاَقِيمُوا الْوَزْنَ بِالْقِسْطِ وَلَا تُخْسِرُوا الْمِيزَانَ) Hər bir şeyin ölçüsünü ədalət üzrə yerləşdirib, ədalət ölçüsündə nöqsan edib ziyankar olmayın, əlbəttə hər bir işdə ədaləti nəzərə alıb, zülm və fəsadı tərk edin.**

**10) (وَالْاَرْضَ وَضَعَهَا لِلْاَنَامِ)** - (Ey Məhəmməd), **Allah-Təalanın nemətlərindən biri də budur ki, yeri hər bir məxluqdan ötrü zəlil və alçaq surətdə yaratdı ki, hər bir növ məxluq yerdə yerləşib, məişətləri tamam olsun.**

**11) (فِيهَا فَاكِهَةٌ وَالنَّخْلُ ذَاتُ الْاَكْمَامِ) Həmin yer üzündə hər bir növ meyvələr mövcud olduğu kimi xüsusilə örtü sahibi xurma* ağacı da mövcuddur ki, xurma o örtünün içindən meydana çıxır.**

**(*Qeyd:** *Xurma ağacının ruh sahibi kimi erkəyi və dişisi vardır. Ağacın dişisindən xurma əvvəlcə kisə (örtü) içində meydana çıxır, erkəkdə olan toz kimi şeydən götürüb onun örtüsünü yırtıb, o tozu oraya daxil edirlər və bu əmələ "təbir" deyilir, əgər xurma "təbir" olunmasa o xurma yeyilə bilməz).*

**12) (وَالْحَبُّ ذُو الْعَصْفِ وَالرَّيْحَانُ) Həmin yerdə yarpaqlı hər bir növ dənələr** (buğda, arpa, noxud, mərci və s. bitkilər) **və başqa göyərtilər vardır ki, onlarla həm qidalanıb, həm də ləzzət alarlar.**

**13) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**14) (خَلَقَ الْاِنْسَانَ مِنْ صَلْصَالٍ كَالْفَخَّارِ) Allah-Təala insanı** (Adəmi) **öz kamil qüdrəti ilə quru saxsı kimi bir palçıqdan yaratdı.** (Adəmin torpağı bir neçə surətə daxil olubdur, əvvəlcə palçıq, ondan sonra həmin palçıq qaralıb, çürü-

وَخَلَقَ الْجَٓانَّ مِنْ مَارِجٍ مِنْ نَارٍۚ ﴿١٥﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿١٦﴾ رَبُّ الْمَشْرِقَيْنِ وَرَبُّ
الْمَغْرِبَيْنِۚ ﴿١٧﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿١٨﴾ مَرَجَ الْبَحْرَيْنِ يَلْتَقِيَانِۙ ﴿١٩﴾ بَيْنَهُمَا بَرْزَخٌ لَا
يَبْغِيَانِۚ ﴿٢٠﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ﴿٢١﴾ يَخْرُجُ مِنْهُمَا اللُّؤْلُؤُ وَالْمَرْجَانُۚ ﴿٢٢﴾ فَبِاَيِّ اٰلَٓاءِ
رَبِّكُمَا تُكَذِّبَانِ﴿٢٣﴾

---

yüb, ondan sonra quru saxsı kimi olubdur. Bu ayə onun müəyyən bir halından xəbər verir).

**15)** (وَخَلَقَ الْجَٓانَّ مِنْ مَارِجٍ مِنْ نَارٍۚ) **- Cinləri** (insandan əvvəl) **saf oddan yaratdı.**

**16)** (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) **Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbmı?**

**17)** (رَبُّ الْمَشْرِقَيْنِ وَرَبُّ الْمَغْرِبَيْنِۚ) **- İki şərqi və iki qərbi** (yay şərqinin və qərbinin, qış şərqinin və qərbinin) **tərtib edən Allah-Təaladır.** (Yayda və qışda günlərin uzun və qısa olması səbəbi ilə şərq və qərb – günəşin doğması və batması müxtəlif yerlərdə olduğundan iki şərq və iki qərb sözü işlədildi).

**18)** (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) **Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**19)** (مَرَجَ الْبَحْرَيْنِ يَلْتَقِيَانِۙ بَيْنَهُمَا بَرْزَخٌ لَا يَبْغِيَانِۚ) **Allah-Təala iki dəniz** (şor və şirin suları) **göndərdi. Bir-biriləri ilə qovuşurlar. Lakin Allah-Təalanın kamil qüdrəti ilə onların arasında bir** (pərdə) **maneə vardır ki, bir-birilərinə, şor şirinə, ya şirin şora qarışmayıb, bir-birilərini yox etmirlər. Şor və şirin suyun hər ikisi mövcud olub, hər ikisindən faydalanırsınız.**

**21)** (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) **Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbmı?**

**22)** (يَخْرُجُ مِنْهُمَا اللُّؤْلُؤُ وَالْمَرْجَانُ) **- Onların faydalarından biri budur ki, şor sudan mirvari və mərcan çıxır). Allah-Təala şor suyun içində öz kamil qüdrəti ilə bu iki cavahirin birini heyvanla maddə arasında keçid olan sədəf adlanan şeydən, o birini kiçik, zəlil bir heyvandan çıxan bəsit bir maddədən yaratması onun kamil qüdrətinə dəlil və sübut deyilmi?**

**23)** (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) **Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

وَلَهُ الْجَوَارِ الْمُنْشَاٰتُ فِي الْبَحْرِ كَالْاَعْلَامِۚ ﴿٢٤﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٢٥﴾ كُلُّ مَنْ عَلَيْهَا
فَانٍۚ ﴿٢٦﴾ وَيَبْقٰى وَجْهُ رَبِّكَ ذُو الْجَلَالِ وَالْاِكْرَامِۚ ﴿٢٧﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٢٨﴾ يَسْـَٔلُهُ
مَنْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِۜ كُلَّ يَوْمٍ هُوَ فِي شَاْنٍۚ ﴿٢٩﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٣٠﴾ سَنَفْرُغُ
لَكُمْ اَيُّهَ الثَّقَلَانِۚ ﴿٣١﴾

---

**24) (وَلَهُ الْجَوَارِ الْمُنْشَاٰتُ فِي الْبَحْرِ كَالْاَعْلَامِۚ) - Dənizdə uca dağlar kimi ucalıb, axıb gedən gəmilərin aparılıb gətirilməsi Allah-Təalaya məxsusdur ki, siz insanları öz arzunuza qovuşdurur.**

**25) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**26-27) (كُلُّ مَنْ عَلَيْهَا فَانٍۚ وَيَبْقٰى وَجْهُ رَبِّكَ ذُو الْجَلَالِ وَالْاِكْرَامِۚ) -** (Ey Məhəmməd), **yer üzündəki hər bir şey həlak olub yox olacaqdır. Lakin əzəli və əbədi diri olan, əzəmət və izzət, lütf və rəhmət sahibi olan sənin rəbbin Allah-Təalanın müqəddəs zatıdır, o müqəddəs zata fanilik və yoxluq təsir etməz).**

**28) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?** (Bu ayədə göstərilən nemət fani olduqdan sonra yenidən dirilən möminlərin mükafata qovuşması nemətidir).

**29) (يَسْـَٔلُهُ مَنْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِۜ كُلَّ يَوْمٍ هُوَ فِي شَاْنٍۚ) Göylərdə və yerdə olan məxluqatın hamısının Allah-Təalaya ehtiyacı olub, əllərini onun dərgahına uzadaraq dua-niyaz edib hər bir işlərinin islahını cənab Haqq-dan istəyərlər. (Hərçənd insanlardan bəziləri qafil olub Ondan istəməsələr də də, lakin onların varlığının cənabi Haqqın feyz-bərəkətindən qidalanan bir zərrə olması onların həqiqətən Ona olan ehtiyaclarını göstərir). Allah-Təala hər an bir işdə, yeni bir hal içindədir. Allah-Təalanın bir şeylə məşğul olması, yaratması eyni anda onun başqa bir şeylə də məşğul olmasına, başqa bir şey də yaratmasına mane olmaz.**

**30) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbmı?**

**31) (سَنَفْرُغُ لَكُمْ اَيُّهَ الثَّقَلَانِۚ) Ey cin və insan nəsli, sizdən asi olanlara əzab edib, intiqam almaqdan ötrü hər bir əməldən ayrılıb, sizə əzab edəcəyəm.** (Allah-Təala asilərə əzab etmək işində özünü düşmənindən intiqam almaq üçün hər bir işini tərk edən adama oxşadır, yoxsa Allah-Təalanın bir işlə məşğul olması digər işlərlə məşğul olmasına mane olmaz və O, cismə xas olan sifətlərdən pak və uzaqdır).

فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٣٢﴾ يَا مَعْشَرَ الْجِنِّ وَالْاِنْسِ اِنِ اسْتَطَعْتُمْ اَنْ تَنْفُذُوا مِنْ اَقْطَارِ السَّمٰوَاتِ
وَالْاَرْضِ فَانْفُذُواؕ لَا تَنْفُذُونَ اِلَّا بِسُلْطَانٍۚ ﴿٣٣﴾ فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٣٤﴾ يُرْسَلُ عَلَيْكُمَا شُوَاظٌ
مِنْ نَارٍ وَنُحَاسٌ فَلَا تَنْتَصِرَانِۚ ﴿٣٥﴾ فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٣٦﴾ فَاِذَا انْشَقَّتِ السَّمَآءُ فَكَانَتْ
وَرْدَةً كَالدِّهَانِۚ ﴿٣٧﴾ فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٣٨﴾ فَيَوْمَئِذٍ لَا يُسْئَلُ عَنْ ذَنْبِهٖ اِنْسٌ وَلَا جَآنٌّۚ ﴿٣٩﴾

---

**32) (فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?** (Bu ayədən məqsəd məzlumların zalımlardan intiqam alması nemətidir).

**33) (يَا مَعْشَرَ الْجِنِّ وَالْاِنْسِ اِنِ اسْتَطَعْتُمْ اَنْ تَنْفُذُوا مِنْ اَقْطَارِ السَّمٰوَاتِ وَالْاَرْضِ فَانْفُذُواؕ) Ey cin və insan cəmiyyəti, əgər mənim qəza və qədərimdən qaçmağa, göylərin və yerin çevrəsindən çıxıb, mənim qüdrətimdən xilas olmağa qadir ola bilərsinizsə, qaçın. (لَا تَنْفُذُونَ اِلَّا بِسُلْطَانٍۚ) - Və halbuki ancaq qüvvət və qüdrət ilə qaçıb qurtula bilərsiz, o da ki, sizdə yoxdur. Bəs necə qaçıb, qurtula bilərsiniz?**

**34) (فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı? Məxluqata sahib və qalib olub, hər bir növ nemət və ruzini onlara yetirən Allah-Təalanın himayəsinə daxil olmaq böyük nemət hesab olunur.**

**35) (يُرْسَلُ عَلَيْكُمَا شُوَاظٌ مِنْ نَارٍ وَنُحَاسٌ فَلَا تَنْتَصِرَانِۚ) Ey asi cin və insanlar, elə ki, qəbirdən çıxdınız, Allah-Təala sizə xalis oddan bir alov və** (tüstü) **göndərər, ta ki, od sizi tüstü içində sürüb məhşərə cəm etsin. O vaxt da getməyə bilməzsiniz və sizə kömək edən də olmaz.**

**36) (فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**37) (فَاِذَا انْشَقَّتِ السَّمَآءُ فَكَانَتْ وَرْدَةً كَالدِّهَانِ) - O zaman ki, qiyamət günündə göy yarılacaq, o vaxt saf və şəffaflıqda zeytun yağı kimi, qızılgül rəngində olar.**

**38) (فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**39) (فَيَوْمَئِذٍ لَا يُسْئَلُ عَنْ ذَنْبِهٖ اِنْسٌ وَلَا جَآنٌّ) - Ogünkü gündə** (göy yarılan gündə) **elə bir zaman olar ki, nə günahkar insanlardan və nə də cinlərdən günahları soruşulmaz ki, siz nə günah edibsiniz? Bəlkə günahkarların hamısı məlum olub, cəhənnəm tərəfinə aparılar.**

فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٤٠﴾ يُعْرَفُ الْمُجْرِمُونَ بِسٖيمٰيهُمْ فَيُؤْخَذُ بِالنَّوَاصٖي وَالْاَقْدَامِۚ ﴿٤١﴾
فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ﴿٤٢﴾ هٰذِهٖ جَهَنَّمُ الَّتٖي يُكَذِّبُ بِهَا الْمُجْرِمُونَۢ ﴿٤٣﴾ يَطُوفُونَ بَيْنَهَا وَبَيْنَ
حَمٖيمٍ اٰنٍۚ ﴿٤٤﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ ۟﴿٤٥﴾ وَلِمَنْ خَافَ مَقَامَ رَبِّهٖ جَنَّتَانِۚ ﴿٤٦﴾ فَبِاَيِّ اٰلَٓاءِ
رَبِّكُمَا تُكَذِّبَانِۙ ﴿٤٧﴾ ذَوَاتَٓا اَفْنَانٍۚ ﴿٤٨﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٤٩﴾

---

**40) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**41) (يُعْرَفُ الْمُجْرِمُونَ بِسٖيمٰيهُمْ فَيُؤْخَذُ بِالنَّوَاصٖي وَالْاَقْدَامِۚ) Günahkarlar simaları** (üzlərindəki əlamətləri ilə) **tanınıb, alınları ilə ayaqlarından yaxalanıb, zəncirə çəkilib cəhənnəmə daxil olarlar.**

**42) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**43-44) (هٰذِهٖ جَهَنَّمُ الَّتٖي يُكَذِّبُ بِهَا الْمُجْرِمُونَۢ يَطُوفُونَ بَيْنَهَا وَبَيْنَ حَمٖيمٍ اٰنٍۚ) Elə ki, onları cəhənnəmə tərəf apardılar, o vaxt onlara deyilər: "Bu, həmin cəhənnəmdir ki, sizin kimi günahkarlar onu təkzib edirdilər. İndi sizin kimi günahkarlar cəhənnəmin odu ilə son dərəcə qaynar suyun arasında dolanıb qalıb, heç cür xilas olmağa qadir olmazlar."**

**45) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı? (Bu ayələrdə Allah-Təalanın nemətindən məqsəd möminlərin qeyd olunan əzablardan qurtuluşudur).**

**46) (وَلِمَنْ خَافَ مَقَامَ رَبِّهٖ جَنَّتَانِۚ) - O şəxs ki, rəbbi Allah-Təalanın məqamından - onun hər bir əməlinə nəzarət edib, qeyd etməsindən qorxur, belə şəxsdən ötrü axirətdə iki cənnət vardır.**

**47) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**48) (ذَوَاتَٓا اَفْنَانٍۚ) - O cənnətlərin ağaclarının hamısının meyvə verən budaqları var.**

**49) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbmı?**

فِيهِمَا عَيْنَانِ تَجْرِيَانِۚ ﴿٥٠﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٥١﴾ فِيهِمَا مِنْ كُلِّ فَاكِهَةٍ زَوْجَانِۚ ﴿٥٢﴾
فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٥٣﴾ مُتَّكِـِٔينَ عَلٰى فُرُشٍ بَطَائِنُهَا مِنْ اِسْتَبْرَقٍۜ وَجَنَا الْجَنَّتَيْنِ دَانٍۚ ﴿٥٤﴾
فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٥٥﴾ فِيهِنَّ قَاصِرَاتُ الطَّرْفِۙ لَمْ يَطْمِثْهُنَّ اِنْسٌ قَبْلَهُمْ وَلَا جَٓانٌّۚ ﴿٥٦﴾
فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِۚ ﴿٥٧﴾ كَاَنَّهُنَّ الْيَاقُوتُ وَالْمَرْجَانُۚ ﴿٥٨﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ﴿٥٩﴾

---

**50) (فِيهِمَا عَيْنَانِ تَجْرِيَانِۚ) - O cənnətlərin hər birində iki dənə çeşmə vardır ki, şirin sularla axırlar.**

**51) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbmı?**

**52) (فِيهِمَا مِنْ كُلِّ فَاكِهَةٍ زَوْجَانِۚ) - O cənnətlərdə hər bir meyvələrdən iki cür (iki növ) meyvə olacaqdır.**

**53) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbmı?**

**54) (مُتَّكِـِٔينَ عَلٰى فُرُشٍ بَطَائِنُهَا مِنْ اِسْتَبْرَقٍۜ وَجَنَا الْجَنَّتَيْنِ دَانٍۚ) - Möminlər həmin cənnətlərdə astarı qalın ipəkdən olan döşəklərə söykənərlər.** (Astar ipəkdən olanda döşəyin üzü gör nədən olacaq?) **Möminlər üçün o cənnətlərin meyvələrini dərmək asan olar. Ayaqüstü durub, ya da əyləşən halda, hər iki halda da meyvələri asanlıqla dərərlər.**

**55) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbmı?**

**56) (فِيهِنَّ قَاصِرَاتُ الطَّرْفِۙ لَمْ يَطْمِثْهُنَّ اِنْسٌ قَبْلَهُمْ وَلَا جَٓانٌّ) Həmin axirətdə, cənnətlərdə gözlərini ancaq ərlərinə dikmiş, başqalarının ərinə baxmayan hurilər vardır ki, ərlərindən qabaq onlara nə bir insan və nə bir cin yaxınlaşmayıb, bəkarətlərini pozmayıbdır.**

**57) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**58) (كَاَنَّهُنَّ الْيَاقُوتُ وَالْمَرْجَانُ) - O hurilərin surətləri saf və qırmızıyla qarışmış olub, sanki yaqut və mərcandırlar.** (Bəh-bəh, heyvani şəhvət arzusu olanlara müjdə olsun!)

**59) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu**

هَلْ جَزَٓاءُ الْاِحْسَانِ اِلَّا الْاِحْسَانُۚ ﴿٦٠﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٦١﴾ وَمِنْ دُونِهِمَا جَنَّتَانِۚ
﴿٦٢﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِۙ ﴿٦٣﴾ مُدْهَٓامَّتَانِۚ ﴿٦٤﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِۚ ﴿٦٥﴾ فِيهِمَا
عَيْنَانِ نَضَّاخَتَانِۚ ﴿٦٦﴾ فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِۚ ﴿٦٧﴾ فِيهِمَا فَاكِهَةٌ وَنَخْلٌ وَرُمَّانٌۚ ﴿٦٨﴾ فَبِاَيِّ
اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِۚ ﴿٦٩﴾ فِيهِنَّ خَيْرَاتٌ حِسَانٌۚ ﴿٧٠﴾

---

**nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**58) (هَلْ جَزَٓاءُ الْاِحْسَانِ اِلَّا الْاِحْسَانُ) Yaxşı əməlin qarşılığı ancaq yaxşı savabdır.** (Yaxşı əməl sahibinə gərək yaxşı savab verilsin).

**61) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**62) (وَمِنْ دُونِهِمَا جَنَّتَانِۚ) - Əvvəl qeyd olunan iki cənnətdən əlavə möminlərdən ötrü iki başqa cənnət də vardır.**

**63) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**64) (مُدْهَٓامَّتَانِۚ) - O cənnətlərin ağacları sudan tox olub yaşıllığın şiddətindən rəngləri qaralıbdır.**

**65) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**66) (فِيهِمَا عَيْنَانِ نَضَّاخَتَانِۚ) - O cənnətlərin hər birində qaynayıb fışqıran iki şirin sulu çeşmə vardır.**

**67) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**68) (فِيهِمَا فَاكِهَةٌ وَنَخْلٌ وَرُمَّانٌ) - O cənnətlərdə hər bir növ meyvələr, xüsusən xurma və nar vardır.**

**69) (فَبِاَيِّ اٰلَٓاءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**70) (فِيهِنَّ خَيْرَاتٌ حِسَانٌ) - O cənnətlərdə mövcud olan nemətlərə sahib olan gözəl üzlü, gözəl xasiyyətli hurilər vardır.**

فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِۚ ﴿٧١﴾ حُورٌ مَقْصُورَاتٌ فِي الْخِيَامِۚ ﴿٧٢﴾ فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِۚ ﴿٧٣﴾ لَمْ يَطْمِثْهُنَّ اِنْسٌ قَبْلَهُمْ وَلَا جَآنٌّۚ ﴿٧٤﴾ فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِۚ ﴿٧٥﴾ مُتَّكِـِٔينَ عَلٰى رَفْرَفٍ خُضْرٍ وَعَبْقَرِيٍّ حِسَانٍۚ ﴿٧٦﴾ فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ ﴿٧٧﴾ تَبَارَكَ اسْمُ رَبِّكَ ذِي الْجَلَالِ وَالْاِكْرَامِ ﴿٧٨﴾

---

**71) (فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**72) (حُورٌ مَقْصُورَاتٌ فِي الْخِيَامِ) - O hurilər məskun olduqları çadırlarda iffətli və örtülü olub, kənara çıxmayıb, ancaq ərləri ilə xoş münasibətdə, məşğul olarlar.**

**73) (فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**74) (لَمْ يَطْمِثْهُنَّ اِنْسٌ قَبْلَهُمْ وَلَا جَآنٌّ) - O hurilərə ərlərindən əvvəl nə bir insan, nə cinlərdən bir kəs yaxınlaşmayıb, bəkarətlərini pozmayıbdır.**

**75) (فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**76) (مُتَّكِـِٔينَ عَلٰى رَفْرَفٍ خُضْرٍ وَعَبْقَرِيٍّ حِسَانٍ) Gözəl ipəkdən və yaşıl qumaşdan olan döşəklərə söykənib, istirahət edib, bir-biriləri ilə söhbətlə məşğul olarlar.**

**77) (فَبِاَيِّ اٰلَآءِ رَبِّكُمَا تُكَذِّبَانِ) Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?**

**78) (تَبَارَكَ اسْمُ رَبِّكَ ذِي الْجَلَالِ وَالْاِكْرَامِ)** - (Ey Məhəmməd), **əzəmət və rəhmət sahibi olan sənin rəbbin Allah-Təalanın adı uca, xeyirli və bərəkətlidir. Gərək hər bir məqamda ona təzim və təqdis edib həmd-səna edəsiniz. Çünki hər bir eyib və nöqsandan uzaq, həmd-səna edilməyə layiq olan müqəddəs bir zatdır.**

**Allaha həmd olsun. ər-Rəhman surəsinin təfsiri tamamlandı. "Ey cin və insan nəsli, bu nemətləri düşünün, rəbbiniz Allah-Təalanın hansı nemətlərini təkzib edə bilərsiniz? Bəs bu nemətlər sizdən ötrü yaradılmayıbdırmı?" ayəsi hər bir nemətin müqabilində əsl həqiqi nemət verən Allah-Təalaya şükür edib, həmd-səna etməyin vacib olduğunu təkid**

**etməkdən ötrü təkrarlandı. Allahın Rəsulu buyurdular: "Kim ki, ər-Rəhman surəsini oxusa, Allah-Təalanın ona verdiyi nemətlərin şükrünü yerinə yetirmiş olar".**

## əl-VAQİƏ SURƏSİ

56-cı surədir. Məkkədə nazil olub, 96 ayə, 342 kəlmə və 1423 hərfdir.

اِذَا وَقَعَتِ الْوَاقِعَةُ ۙ ﴿١﴾ لَيْسَ لِوَقْعَتِهَا كَاذِبَةٌ ۘ ﴿٢﴾ خَافِضَةٌ رَافِعَةٌ ۙ ﴿٣﴾ اِذَا رُجَّتِ الْاَرْضُ رَجًّا ۙ
﴿٤﴾ وَبُسَّتِ الْجِبَالُ بَسًّا ۙ ﴿٥﴾ فَكَانَتْ هَبَٓاءً مُنْبَثًّا ۙ ﴿٦﴾ وَكُنْتُمْ اَزْوَاجًا ثَلٰثَةً ۗ ﴿٧﴾ فَاَصْحَابُ الْمَيْمَنَةِ
مَٓا اَصْحَابُ الْمَيْمَنَةِ ۜ ﴿٨﴾ وَاَصْحَابُ الْمَشْـَٔمَةِ مَٓا اَصْحَابُ الْمَشْـَٔمَةِ ۜ ﴿٩﴾ وَالسَّابِقُونَ السَّابِقُونَ
ۙ ﴿١٠﴾ اُو۬لٰٓئِكَ الْمُقَرَّبُونَ ۚ ﴿١١﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (اِذَا وَقَعَتِ الْوَاقِعَةُ)** - (Ey Məhəmməd), **o zaman ki, qiyamət mütləq vaqe olacaq.**

**2) (لَيْسَ لِوَقْعَتِهَا كَاذِبَةٌ) - O vaxt heç kim Allah-Təalaya yalan isnad edib, qiyaməti təkzib edə bilməz. (Qiyamət günündə hamı doğru və mömin olar. Lakin ogündəki iman sahibinə fayda verməyəcəkdir).**

**3) (خَافِضَةٌ رَافِعَةٌ) Qiyamət bir camaatı** (Allah-Təalaya asi olanları) **zəlil və həqir edib, başqa bir camaatı** (möminləri) **uca dərəcələrə yetirəndir.**

**4) (اِذَا رُجَّتِ الْاَرْضُ رَجًّا) - O zaman ki,** (qiyamət günündə) **yer şiddətlə hərəkətə gəldi,**

**5) (وَبُسَّتِ الْجِبَالُ بَسًّا) - Və dağlar bir-birindən aralanıb, dağılıb, un kimi oldu,**

**6) (فَكَانَتْ هَبَٓاءً مُنْبَثًّا) - Ondan sonra toz olub, havada parçalanıb, fani oldular. O vaxt heç kim Allah-Təalaya yalan isnad edə bilməz.**

**7) (وَكُنْتُمْ اَزْوَاجًا ثَلٰثَةً) Siz insanlar qiyamət günündə üç sinif olacaqsınız.**

**8) (فَاَصْحَابُ الْمَيْمَنَةِ مَٓا اَصْحَابُ الْمَيْمَنَةِ)** (Birinci sinif) **- sağ tərəfin əhli uca dərəcə sahibidirlər.** (Necə ki, dünyada sultanlar öz yavərlərindən uca dərəcə sahiblərinə sağ tərəflərində yer verərlər), **amma** (Ey Məhəmməd), **sağ tərəfdəkilərin əhvalı necədir və hansı dərəcə sahibidirlər, heç kim ona agah deyildir. Çox böyük dərəcə sahibidirlər.**

**9) (وَاَصْحَابُ الْمَشْـَٔمَةِ مَٓا اَصْحَابُ الْمَشْـَٔمَةِ)** (İkinci sinif) **- sol tərəfin əhli əzab sahibidirlər. Amma (Ey Məhəmməd), sol tərəfdəkilərin əhvalı necədir və nə pis dərəcə sahibidirlər. Kimsə ona agah deyildir. Çox pis və alçaq dərəcə sahibidirlər.**

**10-11) (وَالسَّابِقُونَ السَّابِقُونَ ۙ اُو۬لٰٓئِكَ الْمُقَرَّبُونَ)** (Üçüncü sinif) **öndə olanlardır ki,**

فِي جَنَّاتِ النَّعِيمِ ﴿١٢﴾ ثُلَّةٌ مِنَ الْاَوَّلِينَ ﴿١٣﴾ وَقَلِيلٌ مِنَ الْاٰخِرِينَ ﴿١٤﴾ عَلٰى سُرُرٍ مَوْضُونَةٍ
﴿١٥﴾ مُتَّكِئِينَ عَلَيْهَا مُتَقَابِلِينَ ﴿١٦﴾ يَطُوفُ عَلَيْهِمْ وِلْدَانٌ مُخَلَّدُونَ ﴿١٧﴾ بِاَكْوَابٍ وَاَبَارِيقَ
وَكَاْسٍ مِنْ مَعِينٍ ﴿١٨﴾ لَا يُصَدَّعُونَ عَنْهَا وَلَا يُنْزِفُونَ ﴿١٩﴾ وَفَاكِهَةٍ مِمَّا يَتَخَيَّرُونَ ﴿٢٠﴾ وَلَحْمِ
طَيْرٍ مِمَّا يَشْتَهُونَ ﴿٢١﴾ وَحُورٌ عِينٌ ﴿٢٢﴾ كَاَمْثَالِ اللُّؤْلُؤِ الْمَكْنُونِ ﴿٢٣﴾

---

**din və imanları sırf Allah-Təaladan ötrüdür. Onlardır Allah-Təalaya yaxın olanlar.**

**12) (فِي جَنَّاتِ النَّعِيمِ) Allah-Təalaya yaxın olanların məqamı həmişəlik cənnətlərdə olar.**

**13) (ثُلَّةٌ مِنَ الْاَوَّلِينَ) -** (Ey Məhəmməd), **öndə olanların əksəriyyəti sənin ilk ümmətindən olub, sonrakı müsəlmanlardan sayca çox olar.**

**14) (وَقَلِيلٌ مِنَ الْاٰخِرِينَ)* Öndəkilərin** (Allah-Təalaya yaxın olanların) **az bir qismi də sonra, axır zamanlarda gələnlərdən olar.**

**15) (عَلٰى سُرُرٍ مَوْضُونَةٍ) - O öndəkilər həmin cənnətlərdə qızıldan tərtib edilmiş və cəvahirat və mirvari ilə bəzədilmiş taxtların üstündə olacaq.**

**16) (مُتَّكِئِينَ عَلَيْهَا مُتَقَابِلِينَ) Taxtlara söykənib, bir-biriləri ilə üzbəüz oturub, söhbət etməklə məşğul olarlar.**

**17-18) (يَطُوفُ عَلَيْهِمْ وِلْدَانٌ مُخَلَّدُونَ بِاَكْوَابٍ وَاَبَارِيقَ وَكَاْسٍ مِنْ مَعِينٍ) Həmişə bir halda qalıb, dəyişməyən gözəl uşaqlar böyük qablar və kuzələr və kasalarla dolu çeşmədən axan şərabla o öndəkilərin ətrafına dolanıb, onlara içki verərlər.**

**19) (لَا يُصَدَّعُونَ عَنْهَا وَلَا يُنْزِفُونَ) - O şərab elə şərabdır ki, ondan nə başları ağrımaz, nə də məst olmazlar. (Necə ki, dünya şərabında bu xüsusiyyətlər vardır və bu səbəbdən dünya şərabını içənlər o şərabdan məhrum olacaqdır).**

**20-21) (وَفَاكِهَةٍ مِمَّا يَتَخَيَّرُونَ وَلَحْمِ طَيْرٍ مِمَّا يَشْتَهُونَ) - O öndəkilər üçün seçdikləri meyvələrdən və istədikləri quş ətlərindən vardır.**

**22-23) (وَحُورٌ عِينٌ كَاَمْثَالِ اللُّؤْلُؤِ الْمَكْنُونِ) Həmin cənnətlərə öndəkilər üçün sədəf daxilində örtülü olan mirvari kimi iri gözlü hurilər vardır.**

**(*Qeyd:** *"Bu ayəyə diqqət olunsun ki, islamın ilk dövrlərində öndəkilərin (Allah-Təalaya yaxın olanların) sayca çox olub, bizdən öndə olanların (Allah-Təalaya yaxın olanların) sayca az olmasının səbəbi nədir? Səbəbi ancaq onların islamın (Quranın) qanun və ehkamına möhkəm yapışıb, birlik və ittifaq içində*

*olub, bizim isə Quranı tərk edib, təfriqə və nifaq içində olmamızdır. Allah-Təala bu ayədə bizim bu günkü əhvalımızı xəbər verib, bizdən öndə olanların az olduğunu, yəni islamın ehkam və qanunlarına rəğbət etmədiyimizi bəyan edir. Görəsən, ayələrdən ibrət alıb, islam təəssübü və qeyrəti bizdə zühur etməzmi? Bu nə diqqətsizlik və qəflətdir ki, islam ümmətində müşahidə olunur. Din və ümmət qeyrəti yox olub, cəhalət yayılıb, zəmanəmiz cahiliyyət zamanı adlanmağa layiq olubdur. Digər millətlərdə elm rəvac tapdıqca, bizdə də cəhalət rəvac tapır. Bir də fiqh elminə xüsusilik verib, başqa elmləri öyrənənləri təkfir edirlər. Bizim keçmiş hikmət sahiblərinin sahib olduqları elmlər hanı, necə oldu? Alimlərin fəxri, şeyximiz əl-Bəhayi Təbərsi (Allah ondan razı olsun) otuz il zəhmət çəkib, riyaziyyat, astronomiya, həndəsə və digər elmlərdə alim olarkən, fəqihlər onu alim hesab etmirlər və halbuki cənab şeyxin ortaya qoyduğu elmlərin biri də onlarda yoxdur. Riyaziyyat, coğrafiya, tarix elmlərinin vacibliyini Qurani-Şərif bəyan edir. Özlərini islam ümmətinin rəisi adlananlar uydurma, mənasız sözlərə o qədər uyublar ki, hətta islam qanunlarını ehtiva edən xətasız şəriətin mahiyyətinə və tarixinə də agah deyildirlər. Burada yadıma bir əhvalat düşdü. Qeyd etməkdə fayda görürəm, neçə illər bundan əvvəl bir məclisdə o bölgənin əksər alimləri də orada ikən nadir rast gəlinən bir alim peyğəmbərin Mədinəyə getməsindən sonrakı dövrdə səhabənin həyatı haqqında söhbət edirdi. Bu söhbət əsnasında mən həqirin dilindən Evs və Xəzrəc sözləri çıxdı. Bizə yaxın əyləşən bir nəfər alim ki, özünü Bakı şəhərində birinci alim hesab edib, camaat da ona inanırdı, bizim söhbətimizə guya qulaq asırdı, bu sözlər mən həqirin ağzından çıxan kimi həmin alim sözümüzü yadırğayaraq mən həqirə yönəlib dedi: "Evs-Xəzrəc nədir? Mən həqir cavab verib dedim: "Onlar yeməli şeylərdirlər. Ondan sonra dedim: "Cənab, belə məlum olur ki, siz alicənab peyğəmbərin əhvalatına agah deyilsiniz". Cavab verib dedi: "Siz maşallah belə artıq şeylərə fikir verirsiniz, amma mənim belə şeylərə həvəsim yoxdur". Doğrudan da Evs-Xəzrəc nədir? Mən həqir onun halına təəccüb etmədim, çünki şikayət etməkdən başqa heç bir şeyə agah olmadığını bilirdim. Müxtəsər şəkildə dedim ki, Evs-Xəzrəc Mədinə əhlindən iki böyük tayfa idilər ki, onlar peyğəmbərə iman edib, "ənsar" (köməkçi) adıyla adlanırlar. İslam dininə rövnəq və qüvvət veriblər. Allahın Rəsuluna can və malları ilə beyət etdilər. Məkkədən gələn mühacirlərə ev verdilər. (Mühacir sözünü deyəndə fikirləşdim ki, indi axund deyəcək ki, mühacir nədir? Gərək ondan ötrü də əlavə izah verim, yaxşıdır ki, ona diqqət etmədi). Mallarını mühacirlərlə paylaşdılar. Peyğəmbər Məkkədən hicrət etməmiş Mədinədə peyğəmbərin vəkili Müsab ibn Umeyrin dəvəti ilə iman etdilər. Onların bəzisi iki dəfə Məkkəyə gedib, gecə vaxtı Məkkədən kənarda peyğəmbərə beyət edib, onu Mədinəyə gəlməyə həvəsləndirdilər. O cümlədən Evs tayfasının rəislərindən Sə`d ibn Muaz və Xəzrəc*

*tayfasının rəislərindən Sə`d ibn Übadənin islam dininə böyük xidmətləri olubdur. Bu məqama yetişəndə cənab axund başını qaldırıb dedi: "Demək, belə imiş, həqiqətən, yaxşı sözlərdir. Mənim hafizəm zəifdir. İndi siz düşünün ki, biçarə müsəlmanlar islam aləminin əksər yerlərində belə şəxslərin əlinə düşüb, bunları peyğəmbərin xas vəkili hesab edib, hökmlərinə itaət etməyi vacib sayırlar. Onlar da özlərini ümmətin rəisi, itaət və ehtirama, hətta əl-ayaqlarının öpülüb, insanların üzlərinə sürtülməsinə layiq hesab edirlər. Onlara demək lazımdır ki, bir şəxs fiqhdən beş məsələni bilməklə islam ümmətinə rəis və ağa hesab olunub, xalq da onun əlini, ayağını öpməlidir? Əksinə, belə şəxslərin bəzisinin əl-ayağını öpmək əvəzinə kəsmək lazımdır. Rəis və ağa o şəxs hesab olunar ki, islam dininin qanunlarına agah olmaqla birlikdə millətin tərəqqisi üçün mümkün olduqca səy edib, çalışsın, necə ki, islamın ilk dövründəkilər belə olublar, nəinki bizim kimi dirhəm, dinar, ya da ki, hakimiyyət arzusunda olublar. Həqiqətən o sifətlərə sahib olanlar heç elə iddialar etməyiblər ki, bunlar edirlər. Əmirəl-möminin Əli (ə.s) və digər səhabələr o qədər fəzilət və kamallarına və millət yolunda o qədər çalışmalarına baxmayaraq heç vaxt əllərini öpdürməyə razı olmayıblar. Hətta özlərini xalqdan aşağı sayıblar, islama xidmət etməyi özləri üçün iftixar sayıb, özlərini din və millətə xidmətçi sayırdılar. Nəinki islamı özlərinə alət edib, özlərini millətə hakim olmağa layiq hesab edirdilər. Əmirəl-möminin Əli qulamı Qənbər ilə yol gedəndə bir yerdə gedər, onları tanımayanlar Əli ilə qulamını bir-birindən fərqləndirə bilməzdi və Qənbərin libası da ağasının libasından yaxşı olardı. Libas alanda yaxşısını Qənbərə verərdi və bu səbəbdən yamaqlı paltar geyib, torpaq üstündə divar kölgəsində yatardı. Xəlifə olandan sonra Səlmana dedi: "Məndə şəriətə və insafa zidd nə görürsən? Səlman dedi: "Qış libasını yayda, yay libasını qışda saxlamağından başqa bir şey görmürəm. Dedi: "Əhd eylədim ki, daha libas saxlamayım. Belə rəislər islamı yayıb, yer kürəsinin əksər hissəsini islamlaşdırdılar, bununla belə təkəbbürlənməyib, özlərini başqalarından üstün saymadılar. Şəriət sahibinin (Hz. Məhəmmədin) sünnəsinə tabe olub, möminlərə ədaləti, insafı, bərabərliyi əmr edib, islamı yaydılar. İslam ümməti onlara elə itaət edirdilər ki, indi heç qılınc, top, tüfəng qorxusundan elə itaət etmirlər. Çünki onlar özlərini xalqa xidmətçi və xalqı özlərinə şərik sayıb, hər bir işi onların məşvərəti ilə həll edirdilər. Nəinki özlərini onlara sahib sayıb, bununla iftixar edib təkəbbürlənirdilər. Heyhat, riyakar rəislərdən din və islam ümmətinə bir mədəd olmaz. İlahi, zəif müsəlmanların din düşmənləri haqqında olan duasını Nuhun duası kimi qəbul et. Amin! Millətini sevən və dindar şəxslərin bu mətləbə diqqət etməsini rica edirəm).*

جَزَآءً بِمَا كَانُوا يَعْمَلُونَ ﴿٢٤﴾ لَا يَسْمَعُونَ فِيهَا لَغْوًا وَلَا تَأْثِيمًاۙ ﴿٢٥﴾ اِلَّا قِيلًا سَلَامًا
سَلَامًا ﴿٢٦﴾ وَاَصْحَابُ الْيَمِينِ مَآ اَصْحَابُ الْيَمِينِۜ ﴿٢٧﴾ فِي سِدْرٍ مَخْضُودٍۙ ﴿٢٨﴾ وَطَلْحٍ
مَنْضُودٍۙ﴿٢٩﴾ وَظِلٍّ مَمْدُودٍۙ﴿٣٠﴾ وَمَآءٍ مَسْكُوبٍۙ﴿٣١﴾ وَفَاكِهَةٍ كَثِيرَةٍۙ﴿٣٢﴾ لَا مَقْطُوعَةٍ وَلَا
مَمْنُوعَةٍۙ﴿٣٣﴾ وَفُرُشٍ مَرْفُوعَةٍۜ﴿٣٤﴾ اِنَّٓا اَنْشَاْنَاهُنَّ اِنْشَآءًۙ ﴿٣٥﴾فَجَعَلْنَاهُنَّ اَبْكَارًاۙ ﴿٣٦﴾ عُرُبًا
اَتْرَابًاۙ ﴿٣٧﴾ لِاَصْحَابِ الْيَمِينِۜ ﴿٣٨﴾

---

**24) (جَزَآءً بِمَا كَانُوا يَعْمَلُونَ) - Bu qeyd olunan nemətlər öndəkilər üçün əməllərinə görə mükafat və savabdır.**

**25-26) (لَا يَسْمَعُونَ فِيهَا لَغْوًا وَلَا تَأْثِيمًاۙ اِلَّا قِيلًا سَلَامًا سَلَامًا) Həmin cənnətlərdə öndəkilər bir-birilərinə salam verməkdən başqa boş və mənasız sözlər eşitməzlər. Onlardan başqa boş söz çıxmaz.**

**27) (وَاَصْحَابُ الْيَمِينِ)**

**(مَآ اَصْحَابُ الْيَمِينِۜ)** (Öndəkilərin əhvalını bəyan edəndən sonra (birinci sinifin) sağ tərəfdəkilərin əhvalının bəyanını buyurur:) **Ey Məhəmməd, sağ tərəfdəkilər** (uca mərtəbə sahibləri) **hansı məqam və dərəcə sahibidir və halları necədir? Heç kim ondan agah deyildir.** (Bundan sonra qeyd olunan nemətlərə sahibdirlər).

**28) (فِي سِدْرٍ مَخْضُودٍۙ) Tikansız gilas ağacının meyvəsinə,**

**29) (وَطَلْحٍ مَنْضُودٍۙ) - Dibindən ucuna kimi meyvələri olan banan ağacının meyvəsinə,**

**30) (وَظِلٍّ مَمْدُودٍۙ) heç vaxt əskilməyən kölgəyə** (şəfəqin çıxması ilə günəşin doğması arasında olan kölgə kimi),

**31) (وَمَآءٍ مَسْكُوبٍۙ) həmişə axan sulara,**

**32) (وَفَاكِهَةٍ كَثِيرَةٍۙ لَا مَقْطُوعَةٍ وَلَا مَمْنُوعَةٍۙ) - Dərməklə qurtarmayan və qadağan edilməyən meyvələrə,**

**34) (وَفُرُشٍ مَرْفُوعَةٍۜ) - Dünya qadınlarından gözəllikdə, fəzilətdə və ədəbdə uca və ali olan qadınlara, "Tikansız gilas ağacının meyvəsində" ayəsindən bəri qeyd olunan nemətlərə sahib olarlar.**

**35) (اِنَّٓا اَنْشَاْنَاهُنَّ اِنْشَآءً)** - (Ey Məhəmməd), **həqiqətən, biz o qadınları yaradarkən doğuşsuz yaratdıq.** (Bu qadınlar hurilərdən başqa qadınlardır).

**36-37-38) (فَجَعَلْنَاهُنَّ اَبْكَارًاۙ عُرُبًا اَتْرَابًاۙ لِاَصْحَابِ الْيَمِينِۜ ) - Onların hamısını bakirə, ərlərini sevən, ərləri ilə gözəl rəftar edən, hamısını bir yaşda etdik, sağ tərəfdəkilər üçündür onlar.** (Hədisdə varid olubdur ki, o qadınların hamısı cənnətdə 33 yaşında olarlar).

ثُلَّةٌ مِنَ الْاَوَّلٖينَۙ ﴿٣٩﴾ وَثُلَّةٌ مِنَ الْاٰخِرٖينَۜ ﴿٤٠﴾ وَاَصْحَابُ الشِّمَالِۙ مَٓا اَصْحَابُ الشِّمَالِؕ ﴿٤١﴾
فٖي سَمُومٍ وَحَمٖيمٍۙ ﴿٤٢﴾ وَظِلٍّ مِنْ يَحْمُومٍۙ ﴿٤٣﴾ لَا بَارِدٍ وَلَا كَرٖيمٍ ﴿٤٤﴾ اِنَّهُمْ كَانُوا قَبْلَ ذٰلِكَ
مُتْرَفٖينَۚ ﴿٤٥﴾ وَكَانُوا يُصِرُّونَ عَلَى الْحِنْثِ الْعَظٖيمِۚ ﴿٤٦﴾ وَكَانُوا يَقُولُونَ اَئِذَا مِتْنَا وَكُنَّا تُرَابًا وَعِظَامًا
ءَاِنَّا لَمَبْعُوثُونَۙ ﴿٤٧﴾ اَوَاٰبَٓاؤُ۬نَا الْاَوَّلُونَ ﴿٤٨﴾ قُلْ اِنَّ الْاَوَّلٖينَ وَالْاٰخِرٖينَۙ ﴿٤٩﴾ لَمَجْمُوعُونَ اِلٰى
مٖيقَاتِ يَوْمٍ مَعْلُومٍ ﴿٥٠﴾ ثُمَّ اِنَّكُمْ اَيُّهَا الضَّٓالُّونَ الْمُكَذِّبُونَۙ ﴿٥١﴾ لَاٰكِلُونَ مِنْ شَجَرٍ مِنْ زَقُّومٍۙ ﴿٥٢﴾

---

**39-40) (ثُلَّةٌ مِنَ الْاَوَّلٖينَۙ وَثُلَّةٌ مِنَ الْاٰخِرٖينَ) Sağ tərəfdəkilərin çoxu bu ümmətin ilk dövründə olanlardan və həm də onlardan sonra gələn əsrlərdə olanlardandır.**

**41-42) (وَاَصْحَابُ الشِّمَالِۙ مَٓا اَصْحَابُ الشِّمَالِؕ)** (İkinci sinif olan) **sol tərəfdəkilər** (əzab) **əhlidirlər.** (Ey Məhəmməd), **sol tərəfdəkilərin halına və onlara hansı dərəcədə əzab olunacağına heç kim agah deyildir.**

**(فٖي سَمُومٍ وَحَمٖيمٍۙ) Sol tərəfdəkilər içlərinə girən şiddətli od və qaynar su içində olacaqlar.**

**43) (وَظِلٍّ مِنْ يَحْمُومٍۙ) - Onlar kölgədə olacaqlar, lakin kölgələri bir-birinin üstünə yığılan şiddətli qara (duman) tüstüdən olacaqdır.**

**44) (لَا بَارِدٍ وَلَا كَرٖيمٍ) - O kölgədə olan soyuqdan və istidən qorunmaq olmaz. Əksinə, şiddətli isti ilə yandırar.**

**45) (اِنَّهُمْ كَانُوا قَبْلَ ذٰلِكَ مُتْرَفٖينَ) Çünki həqiqətən, sol tərəfdəkilər dünyada hər bir nemət içində olub, nankorluq etdilər və bu səbəbdən belə əzaba layiq oldular.**

**46) (وَكَانُوا يُصِرُّونَ عَلَى الْحِنْثِ الْعَظٖيمِۚ) - Dünyada böyük günahlarda israr dirdilər.**

**47-48) (وَكَانُوا يَقُولُونَ اَئِذَا مِتْنَا وَكُنَّا تُرَابًا وَعِظَامًا ءَاِنَّا لَمَبْعُوثُونَ اَوَاٰبَٓاؤُ۬نَا الْاَوَّلُونَ) - Dünyada məhşəri inkar edib deyirdilər: "Bəs biz və əvvəlki ata-babalarımız o zaman ki, ölüb torpaq və sümük olduq, yenidən dirilib, məhşərə varid olacağıq? Belə iş olan deyildir.**

**49-50) (قُلْ اِنَّ الْاَوَّلٖينَ وَالْاٰخِرٖينَۙ لَمَجْمُوعُونَ اِلٰى مٖيقَاتِ يَوْمٍ مَعْلُومٍ)** - (Ey Məhəmməd), **onların cavabında de ki, həqiqətən, əvvəlkilər və gələnlər** (ata-babalar və övladlar) **hamısı dünyanın sonundan ötrü müəyyən və məlum olan gündə** (qiyamət günündə) **cəm ediləcklər.**

**51-52) (ثُمَّ اِنَّكُمْ اَيُّهَا الضَّٓالُّونَ الْمُكَذِّبُونَ لَاٰكِلُونَ مِنْ شَجَرٍ مِنْ زَقُّومٍۙ) Ey asi və haqqı təkzib edənlər, məhşərə cəm ediləndən sonra həqiqətən, siz cəhənnəmə daxil olub, əlbəttə, (zəqqum) ağacının meyvəsindən yeyəcəksiniz.**

فَمَالِؤُنَ مِنْهَا الْبُطُونَۚ ﴿٥٣﴾ فَشَارِبُونَ عَلَيْهِ مِنَ الْحَمِيمِۚ ﴿٥٤﴾ فَشَارِبُونَ شُرْبَ الْهِيمِۜ ﴿٥٥﴾ هٰذَا
نُزُلُهُمْ يَوْمَ الدِّينِۜ ﴿٥٦﴾ نَحْنُ خَلَقْنَاكُمْ فَلَوْلَا تُصَدِّقُونَۚ ﴿٥٧﴾ اَفَرَاَيْتُمْ مَا تُمْنُونَۜ ﴿٥٨﴾ ءَاَنْتُمْ
تَخْلُقُونَهُ اَمْ نَحْنُ الْخَالِقُونَ ﴿٥٩﴾ نَحْنُ قَدَّرْنَا بَيْنَكُمُ الْمَوْتَ وَمَا نَحْنُ بِمَسْبُوقِينَۙ ﴿٦٠﴾ عَلٰٓى اَنْ
نُبَدِّلَ اَمْثَالَكُمْ وَنُنْشِئَكُمْ ف۪ي مَا لَا تَعْلَمُونَ ﴿٦١﴾ وَلَقَدْ عَلِمْتُمُ النَّشْاَةَ الْاُو۫لٰى فَلَوْلَا تَذَكَّرُونَ ﴿٦٢﴾
اَفَرَاَيْتُمْ مَا تَحْرُثُونَۜ ﴿٦٣﴾ ءَاَنْتُمْ تَزْرَعُونَهُ اَمْ نَحْنُ الزَّارِعُونَ ﴿٦٤﴾

---

**53) (فَمَالِؤُنَ مِنْهَا الْبُطُونَ) Zəqqum ağacının meyvəsi ilə qarınlarınızı dolduracaqsınız.**

**54) (فَشَارِبُونَ عَلَيْهِ مِنَ الْحَمِيمِۚ) - Onun üstündən şiddətli isti sudan içəcəksiniz.**

**55) (فَشَارِبُونَ شُرْبَ الْهِيمِۜ) Atəş xəstəliyi olan** (dəvə) **kimi o sudan içəcəksiniz.**

**56) (هٰذَا نُزُلُهُمْ يَوْمَ الدِّينِۜ) -** (Ey Məhəmməd), **bu qeyd olunan əzablar** (necə ki, qonaqdan ötrü mərasim təşkil edilər) **onlardan ötrü də** (qiyamət) **günündə bir mərasimdir. Bu mərasimə əlbəttə, gərək varid olsunlar.** (İstehza üçün mərasim deyilir).

**57) (نَحْنُ خَلَقْنَاكُمْ فَلَوْلَا تُصَدِّقُونَ) Siz özünüz agahsınız ki, bir şey deyildiniz, biz sizi yaradıb meydana gətirdik. Bununla belə, yenə sizi yenidən yaradıb, məhşərə hazır etməmizi təsdiq etməzsinizmi? Əvvəlki yaradılışa agah oldunuz, ikinci dəfə yaradılmağı da əlbəttə, gərək təsdiq edəsiniz.**

**58) (اَفَرَاَيْتُمْ مَا تُمْنُونَ) Xəbər verin mənə görüm, anaların bətninə atdığınız sperma nədir?**

**59) (ءَاَنْتُمْ تَخْلُقُونَهُ اَمْ نَحْنُ الْخَالِقُونَ) Siz onları təqdir edib, insan surətinə daxil edirsiniz, yoxsa onları yaradan bizik?**

**60-61) (نَحْنُ قَدَّرْنَا بَيْنَكُمُ الْمَوْتَ) Sizi biz yaradıb, ondan sonra ölümü sizin aranızda təqdir edib, müəyyən vaxta kimi qərar vermişik.**

**(وَمَا نَحْنُ بِمَسْبُوقِينَۙ عَلٰٓى اَنْ نُبَدِّلَ اَمْثَالَكُمْ وَنُنْشِئَكُمْ ف۪ي مَا لَا تَعْلَمُونَ) Sizi həlak edib, sizin əvəzinizə sizin kimi məxluq gətirməyə və sizi bilmədiyiniz müxtəlif surətlərdə yaratmağa** (necə ki, belə də edirik) **əlbəttə, biz qadirik və bizi aciz edən də yoxdur.**

**62) (وَلَقَدْ عَلِمْتُمُ النَّشْاَةَ الْاُو۫لٰى فَلَوْلَا تَذَكَّرُونَ) Həqiqətən, özünüzün bir şey olmayıb, ilk dəfə yaradılmağınıza ki, agah oldunuz, bəs niyə agah olmursunuz ki, necə ki, ilk dəfə sizi yaratmağa qadir olduq, ikinci dəfə də buna qadir olarıq.**

**63-64) (اَفَرَاَيْتُمْ مَا تَحْرُثُونَۜ ءَاَنْتُمْ تَزْرَعُونَهُ اَمْ نَحْنُ الزَّارِعُونَ) Xəbər verin mənə görüm, o toxumlar ki, hər bir növ yemək üçün əkirsiniz, siz onları bitirirsiniz, yoxsa biz bitiririk?**

لَوْ نَشَآءُ لَجَعَلْنَاهُ حُطَامًا فَظَلْتُمْ تَفَكَّهُونَ ﴿٦٥﴾ اِنَّا لَمُغْرَمُونَ ۙ﴿٦٦﴾ بَلْ نَحْنُ مَحْرُومُونَ ﴿٦٧﴾
اَفَرَاَيْتُمُ الْمَآءَ الَّذِي تَشْرَبُونَ ؕ﴿٦٨﴾ ءَاَنْتُمْ اَنْزَلْتُمُوهُ مِنَ الْمُزْنِ اَمْ نَحْنُ الْمُنْزِلُونَ﴿٦٩﴾ لَوْ نَشَآءُ
جَعَلْنَاهُ اُجَاجًا فَلَوْلَا تَشْكُرُونَ﴿٧٠﴾ اَفَرَاَيْتُمُ النَّارَ الَّتِي تُورُونَ ؕ﴿٧١﴾ ءَاَنْتُمْ اَنْشَاْتُمْ شَجَرَتَهَآ اَمْ نَحْنُ
الْمُنْشِؤُنَ ﴿٧٢﴾ نَحْنُ جَعَلْنَاهَا تَذْكِرَةً وَمَتَاعًا لِلْمُقْوِينَ ۚ﴿٧٣﴾ فَسَبِّحْ بِاسْمِ رَبِّكَ الْعَظِيمِ ۟﴿٧٤﴾
فَلَآ اُقْسِمُ بِمَوَاقِعِ النُّجُومِ ۙ﴿٧٥﴾

---

**65) (لَوْ نَشَآءُ لَجَعَلْنَاهُ حُطَامًا فَظَلْتُمْ تَفَكَّهُونَ) - Əgər biz istəsək, həmin toxumları yetişməmiş, dənəsiz halda məhv edərik, onlardan heç bir fayda əldə edə bilməzsiniz, o vaxt da o hala təəccüb edərsiniz.**

**66-67) (اِنَّا لَمُغْرَمُونَ ۙ بَلْ نَحْنُ مَحْرُومُونَ) - O vaxt da belə deyərsiniz: "Həqiqətən, biz fayda əldə etmədən borca girdik, malımız faydasız tələf oldu. Yox, hətta hər bir xeyirdən məhrum olub, istədiyimiz əkindən də məhrum olduq.**

**68) (اَفَرَاَيْتُمُ الْمَآءَ الَّذِي تَشْرَبُونَ ؕ) Xəbər verin mənə görüm, bəs o su ki, içirsiniz,**

**69) (ءَاَنْتُمْ اَنْزَلْتُمُوهُ مِنَ الْمُزْنِ اَمْ نَحْنُ الْمُنْزِلُونَ) - Bəs o suyu buludlardan siz endirirsiniz, yoxsa o suyu endirən bizik?**

**70) (لَوْ نَشَآءُ جَعَلْنَاهُ اُجَاجًا فَلَوْلَا تَشْكُرُونَ) - Əgər biz istəsək, yer üzündə olan suların hamısını son dərəcə şor edərik ki, onları içməyə qadir olmayıb, hamınız həlak olarsınız. Bəs niyə belə nemətlərə şükür etmirsiniz?**

**71) (اَفَرَاَيْتُمُ النَّارَ الَّتِي تُورُونَ) Xəbər verin mənə görüm, bu od ki, yandırırsınız?** (Ərəbistan məmləkətində bir cür ağac vardır ki, ərəblər onun yaş budağından iki parça kəsib bir-birinə sürtüb, ondan od çıxarıb, ehtiyaclarını həll edirdilər.)

**72) (ءَاَنْتُمْ اَنْشَاْتُمْ شَجَرَتَهَآ اَمْ نَحْنُ الْمُنْشِؤُنَ) - Bəs bu odun ağacını siz yaradıbsınız, yoxsa onu yaradan bizik?**

**73) (نَحْنُ جَعَلْنَاهَا تَذْكِرَةً وَمَتَاعًا لِلْمُقْوِينَ)** - (Ey Məhəmməd), **biz həmin odu cəhənnəm oduna agah olmanız və qaranlığı, soyuğu dəf edib, hər bir növ yeməkdən faydalanmanız üçün yaratdıq.**

**74) (فَسَبِّحْ بِاسْمِ رَبِّكَ الْعَظِيمِ) Ey insan, bu nemətləri düşünüb, külli məxluqatdan böyük olan rəbbin Allah-Təalanın mübarək adını zikr etməklə onu pak, hər bir eyib və nöqsandan uca, müqəddəs say.**

**75) (فَلَآ اُقْسِمُ بِمَوَاقِعِ النُّجُومِ) - Belə deyil ki, siz deyirsiniz,** (Quranı) **inkar edirsiniz? Əlbəttə, ulduzların səhər vaxtı batma məqamlarına and içirəm.**

وَاِنَّهُ لَقَسَمٌ لَوْ تَعْلَمُونَ عَظِيمٌ ﴿٧٦﴾ اِنَّهُ لَقُرْاٰنٌ كَرِيمٌ ﴿٧٧﴾ فِي كِتَابٍ مَكْنُونٍ ﴿٧٨﴾ لَا يَمَسُّهُ اِلَّا الْمُطَهَّرُونَ ﴿٧٩﴾ تَنْزِيلٌ مِنْ رَبِّ الْعَالَمِينَ ﴿٨٠﴾ اَفَبِهٰذَا الْحَدِيثِ اَنْتُمْ مُدْهِنُونَ ﴿٨١﴾

---

**76) (وَاِنَّهُ لَقَسَمٌ لَوْ تَعْلَمُونَ عَظِيمٌ) - Və həqiqətən, əgər siz bilsəydiniz, ulduzların qürub məqamlarına and içmək böyük* anddır.**

**77) (اِنَّهُ لَقُرْاٰنٌ كَرِيمٌ) And içirəm ki, həqiqətən, (Məhəmmədə) nazil olan Quran faydalı bir kitabdır.**

**78) (فِي كِتَابٍ مَكْنُونٍ) Həmin Quran "lövhi-məhfuz"da** (Allah-Təalanın elmində) **qeyd olunub, saxlanılıbdır.**

**(*Qeyd:** *"Andın böyük olması and içilən şeyin böyük olmasına işarə edir. Bu andın böyük olması astronomiya elminin nə qədər əhəmiyyətli olmasına və ulduzların hər birinin bir aləm olub, onlarda olan məxluqatın həqiqətini imkan ölçüsündə dərk etməyə çalışmağa işarədir. Ulduzlardan başqa da Allah-Təala Qurani-Şərifdə bəzi digər məxluqata and içibdir. Lakin heç birinə and içməyi böyük saymayıb, necə ki, ulduzlara and içməyi böyük sayıbdır. Bu and içmək ulduzların yer kürəsi kimi bir yer olub, əcaib və qəribə məxluqatı ehtiva etməsi səbəbi ilədir və bu səbəbdən ulduzlara and içib, həm Quranın faydasını, həm də ulduzlara lütf bəxş etdiyini isbat edir. Ondan sonra Qurani-Şərifi vəsf edərək, ona qəlbi və xasiyyətləri pak olan şəxslərin toxuna biləcəyini göstərir. Hərçənd təfsirçilərin əksəriyyəti əmrin zahiri mənasına meyil edib, "təharət"ə (təmizliyə) zahiri təmizlik (dəstəmaz və qüsl) mənası verib, "təharət"siz Quran yazısına toxunmağı caiz görməyiblər, lakin bu zahiri məna Qurani-Şərifə layiq olmayan mənadır. Belə məqamda "təharət"dən məqsəd xəbis və rəzil sifətlərdən pak olub, təqva sifətinə sahib olmaqdır. Necə ki, ilahi kəlamların incəliklərinə arif olan ağıl sahibi və maarifpərvər şəxslərə bu məsələ məxfi deyildir. Təfəkkür etmək lazımdır).*

**79) (لَا يَمَسُّهُ اِلَّا الْمُطَهَّرُونَ) Qurana xəbis və rəzil sifətlərdən pak və nöqsansız olan şəxslərdən başqası toxuna bilməz, həqiqət və nicat yolunu göstərən və tabe olunması vacib olan ehkamına da onlardan başqası əməl etməz.**

**80) (تَنْزِيلٌ مِنْ رَبِّ الْعَالَمِينَ) - Bu Quran aləmlərin rəbbi və tərbiyə verəni Allah-Təala tərəfindən nazil olubdur. Onda şəkk və şübhə etmək layiq deyildir.**

**81) (اَفَبِهٰذَا الْحَدِيثِ اَنْتُمْ مُدْهِنُونَ) - Bəs bu Qurani-Şərif ki, Allah-Təaladan nazil olubdur, siz müşriklər nifaq çıxarıb, batil sözlər danışıb, onu təkzib edirsiniz?**

وَتَجْعَلُونَ رِزْقَكُمْ اَنَّكُمْ تُكَذِّبُونَ ﴿٨٢﴾ فَلَوْلَآ اِذَا بَلَغَتِ الْحُلْقُومَ ﴿٨٣﴾ وَاَنْتُمْ حِينَئِذٍ تَنْظُرُونَ
﴿٨٤﴾ وَنَحْنُ اَقْرَبُ اِلَيْهِ مِنْكُمْ وَلٰكِنْ لَا تُبْصِرُونَ﴿٨٥﴾ فَلَوْلَا اِنْ كُنْتُمْ غَيْرَ مَدِينِينَ ﴿٨٦﴾
تَرْجِعُونَهَآ اِنْ كُنْتُمْ صَادِقِينَ ﴿٨٧﴾ فَاَمَّآ اِنْ كَانَ مِنَ الْمُقَرَّبِينَ ﴿٨٨﴾ فَرَوْحٌ وَرَيْحَانٌ وَجَنَّتُ
نَعِيمٍ﴿٨٩﴾ وَاَمَّآ اِنْ كَانَ مِنْ اَصْحَابِ الْيَمِينِ﴿٩٠﴾ فَسَلَامٌ لَكَ مِنْ اَصْحَابِ الْيَمِينِ﴿٩١﴾ وَاَمَّآ
اِنْ كَانَ مِنَ الْمُكَذِّبِينَ الضَّآلِّينَ ﴿٩٢﴾ فَنُزُلٌ مِنْ حَمِيمٍ ﴿٩٣﴾ وَتَصْلِيَةُ جَحِيمٍ ﴿٩٤﴾ اِنَّ هٰذَا لَهُوَ
حَقُّ الْيَقِينِ ﴿٩٥﴾ فَسَبِّحْ بِاسْمِ رَبِّكَ الْعَظِيمِ ﴿٩٦﴾

---

**82) (وَتَجْعَلُونَ رِزْقَكُمْ اَنَّكُمْ تُكَذِّبُونَ) Siz Quranı təkzib edənlər Quranı təsdiq etmək əvəzinə nəsibinizin onun uca məzmununu qəbul etməyib, təkzib etmək olduğunu deyirsiniz? Ağıllı şəxs də belə əməl edərmi?**

**83-84) (فَلَوْلَآ اِذَا بَلَغَتِ الْحُلْقُومَ وَاَنْتُمْ حِينَئِذٍ تَنْظُرُونَ) - O zaman ki, ölüm halında can boğaza yetişdi, bəs niyə siz durub baxıb, ona heç bir çarə etməyib, ölümü ondan dəf etmirsiniz? Əgər qadirsinizsə, ölümü ondan dəf edin.**

**85) (وَنَحْنُ اَقْرَبُ اِلَيْهِ مِنْكُمْ وَلٰكِنْ لَا تُبْصِرُونَ) - Meyitin siz yaxın qohumlarındansa, biz ona daha yaxınıq. Lakin sizin bəsirətiniz olmayıb (kor olub), bilmirsiniz.**

**86-87) (فَلَوْلَا اِنْ كُنْتُمْ غَيْرَ مَدِينِينَ تَرْجِعُونَهَآ اِنْ كُنْتُمْ صَادِقِينَ) - Əgər sizə bir tərbiyə və cəza verən yoxdursa və əgər bu sözünüzdə sadiqsənizsə, bəs niyə meyitin ruhunu qaytarmırsınız ki, həmişə həyat sahibi olub, ölüm ona gəlməsin?**

**88-89) (فَاَمَّآ اِنْ كَانَ مِنَ الْمُقَرَّبِينَ فَرَوْحٌ وَرَيْحَانٌ وَجَنَّتُ نَعِيمٍ) Amma** (ölən) **Allaha yaxın olanlardan** (əvvəl qeyd olunan üç sifət sahibindən) **isə, ondan ötrü nemətləri həmişəlik olan əbədi cənnət və hər bir növ ruzi və rahatlıq vardır.**

**90-91) (وَاَمَّآ اِنْ كَانَ مِنْ اَصْحَابِ الْيَمِينِ فَسَلَامٌ لَكَ مِنْ اَصْحَابِ الْيَمِينِ) Amma** (ölən) **sağ tərəfdəkilərdən olsa, cənnətdə digər sağ tərəfdəkilər ona deyər: "Sağ tərəfdəkilərdən sənə salam olsun. Cənnətə daxil ol.**

**92-93-94) (وَاَمَّآ اِنْ كَانَ مِنَ الْمُكَذِّبِينَ الضَّآلِّينَ فَنُزُلٌ مِنْ حَمِيمٍ وَتَصْلِيَةُ جَحِيمٍ) - Və amma** (ölən) **qiyaməti inkar edən asi şəxslərdən olsa, ondan ötrü cəhənnəmin şiddətli qaynar suyundan** (qonaqdan ötrü olan mərasim kimi) **mərasim vardır.** (Bu kəlam istehza üçündür). **Ondan sonra cəhənnəmə daxil olarlar.**

**95) (اِنَّ هٰذَا لَهُوَ حَقُّ الْيَقِينِ)** - (Ey Məhəmməd), **həqiqətən, bu surədə qeyd olunanlar əlbəttə, haqq və qəti, şəkk və şübhəsi olmayan hökmlərdir.**

**96) (فَسَبِّحْ بِاسْمِ رَبِّكَ الْعَظِيمِ)** - (Ey Məhəmməd), **Allah-Təalanın tövhid və qüdrətini düşünüb, böyük dərəcəsi olan rəbbin Allah-Təalanın mübarək adını zikr etməklə onu hər bir eyib və nöqsandan pak və müqəddəs say.**

**Allaha həmd olsun. Əl-Vaqiə surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurubdur: “Kim əl-Vaqiə surəsini hər gecə oxusa, heç vaxt ona yoxsulluq yetişməz”. Bu hədisə dünyadakı maddi ruzi mənası verib, hər gecə oxuyanların daha da yoxsullaşdığını görürük. Yoxsulluqdan məqsəd cəhalət yoxsulluğudur ki, hər bir şəxs bu mübarək surəni təfəkkür edərək oxuyub, onun ayələrinə lazım olduğu kimi diqqət etsə, əlbəttə, cəhalət yoxsulluğundan nicat tapıb, elmə qovuşar.**

## əl-HADİD SURƏSİ

57-cu surədir. Məkkədə nazil olub, 29 ayə, 544 kəlmə və 2476 hərfdir.

سَبَّحَ لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِۚ وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ ﴿١﴾ لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِۚ يُحْيِي
وَيُمِيتُۚ وَهُوَ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ﴿٢﴾ هُوَ الْاَوَّلُ وَالْاٰخِرُ وَالظَّاهِرُ وَالْبَاطِنُۚ وَهُوَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ
﴿٣﴾ هُوَ الَّذِي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ فِي سِتَّةِ اَيَّامٍ ثُمَّ اسْتَوٰى عَلَى الْعَرْشِۜ يَعْلَمُ مَا يَلِجُ فِي
الْاَرْضِ وَمَا يَخْرُجُ مِنْهَا وَمَا يَنْزِلُ مِنَ السَّمَاءِ وَمَا يَعْرُجُ فِيهَاۜ وَهُوَ مَعَكُمْ اَيْنَ مَا كُنْتُمْۜ وَاللّٰهُ بِمَا
تَعْمَلُونَ بَصِيرٌ ﴿٤﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (سَبَّحَ لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِۚ وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ) Göylərdə və yerdə olan məxluqatın** (ağıllı və ya ağılsız hər şey, hal və ya söz ilə) **hamısı Allah-Təalanı zikr edir. Allah-Təalanın hər bir feili hikmət üzrə olub, öz kamil qüdrəti ilə məxluqata qalibdir.**

**2) (لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِۚ يُحْيِي وَيُمِيتُۚ وَهُوَ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ) Göylərin və yerin hakimiyyəti Allah-Təalaya məxsusdur. Dirildib öldürər və hər bir şeyə qadirdir.**

**3) (هُوَ الْاَوَّلُ) Hər bir şeydən əvvəl, varlığının başlanğıcı olmayan** (qədim) **Allah-Təaladır. (وَالْاٰخِرُ) - Və hər bir şey həlak olandan sonra varlığı salamat qalıb, fani olmayan Allah-Təaladır. (وَالظَّاهِرُ) Zühuruna işarə edən dəlil və sübutla zahir olmağı sabitdir. (وَالْبَاطِنُ) - İnsan nəslinə məxsus olan hissiyyat qüvvələrilə dərk olunmadığı üçün batindir.**

**(وَهُوَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ) - Və hər bir şeydən agah olan Allah-Təaladır.**

**4) (هُوَ الَّذِي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ فِي سِتَّةِ اَيَّامٍ ثُمَّ اسْتَوٰى عَلَى الْعَرْشِۜ) Allah-Təala öz kamil qüdrəti ilə göyləri və yeri miqdarı altı günlük təqdir olunan bir zamanda yaradıb, ondan sonra ərşə** (aləmin hakimiyyət taxtına) **sahib oldu.** (Bu mətləbin tədqiqi əvvəlki surələrdə bəyan olunubdur).

**(يَعْلَمُ مَا يَلِجُ فِي الْاَرْضِ وَمَا يَخْرُجُ مِنْهَا وَمَا يَنْزِلُ مِنَ السَّمَاءِ وَمَا يَعْرُجُ فِيهَاۜ) Yerə daxil olub, yerdən çıxan, göydən enib və göyə qalxan hər bir şeydən Allah-Təala agahdır. (وَهُوَ مَعَكُمْ اَيْنَ مَا كُنْتُمْ) Allah-Təala harda olsanız da, siz insanlarla birlikdə olub və hər bir əməllərinizə baxan və agah olandır.**

**(وَاللّٰهُ بِمَا تَعْمَلُونَ بَصِيرٌ) Allah-Təala sizin hər bir əməllərinizi görür və xəbərdardır.**

لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ وَاِلَى اللّٰهِ تُرْجَعُ الْاُمُورُ ﴿٥﴾ يُولِجُ الَّيْلَ فِي النَّهَارِ وَيُولِجُ النَّهَارَ فِي الَّيْلِۜ وَهُوَ عَلٖيمٌ بِذَاتِ الصُّدُورِ ﴿٦﴾ اٰمِنُوا بِاللّٰهِ وَرَسُولِهٖ وَاَنْفِقُوا مِمَّا جَعَلَكُمْ مُسْتَخْلَفٖينَ فٖيهِۜ فَالَّذٖينَ اٰمَنُوا مِنْكُمْ وَاَنْفَقُوا لَهُمْ اَجْرٌ كَبٖيرٌ ﴿٧﴾ وَمَا لَكُمْ لَا تُؤْمِنُونَ بِاللّٰهِۚ وَالرَّسُولُ يَدْعُوكُمْ لِتُؤْمِنُوا بِرَبِّكُمْ وَقَدْ اَخَذَ مٖيثَاقَكُمْ اِنْ كُنْتُمْ مُؤْمِنٖينَ ﴿٨﴾ هُوَ الَّذٖي يُنَزِّلُ عَلٰى عَبْدِهٖٓ اٰيَاتٍ بَيِّنَاتٍ لِيُخْرِجَكُمْ مِنَ الظُّلُمَاتِ اِلَى النُّورِۜ

---

**5) (لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ وَاِلَى اللّٰهِ تُرْجَعُ الْاُمُورُ) Göylərin və yerin hakimiyyəti Allah-Təalaya məxsusdur və bütün işlər Allah-Təalaya tərəf qaytarılacaq.**

**6) (يُولِجُ الَّيْلَ فِي النَّهَارِ وَيُولِجُ النَّهَارَ فِي الَّيْلِۜ) Allah-Təala öz kamil qüdrəti ilə* gecəni gündüzə daxil edər.** (Gecəni qısa edib, gündüzü uzun edər) **və gündüzü gecəyə daxil edər.** (Gündüzü qısa edib, gecəyə daxil edər).

**(وَهُوَ عَلٖيمٌ بِذَاتِ الصُّدُورِ ) Sinələrdəki gizli sirlərə Allah-Təala agahdır.**

**(*Qeyd:** *"Gecə və gündüzün uzun və ya qısa olmaları keçmiş astronomların dediyi kimi ya günəşin hərəkətindən, ya da müasir astronomların dediyi kimi yerin hərəkətindən qaynaqlanır. Səbəb və nəticənin hər ikisini Allah-Təala özü yaratdığı üçün səbəbi tərk edib, nəticəni (gecə və gündüzün uzun və qısa olmalarını) bilavasitə öz müqəddəs zatına isnad etdi).*

**7) (اٰمِنُوا بِاللّٰهِ وَرَسُولِهٖ وَاَنْفِقُوا مِمَّا جَعَلَكُمْ مُسْتَخْلَفٖينَ فٖيهِۜ) Ey islam dininə dəvət olunanlar, Allah-Təalaya və onun peyğəmbərinə iman edib, Allah-Təalanın sizi üzərində xəlifə** (canişin) **təyin etdiyi mallardan xərcləyib, millətin ehtiyacları üçün sərf edin. (فَالَّذٖينَ اٰمَنُوا مِنْكُمْ وَاَنْفَقُوا لَهُمْ اَجْرٌ كَبٖيرٌ) Sizlərdən o şəxslər ki, iman edib, mallarından xərcləyir, onlardan ötrü Allah-Təalanın yanında böyük əcr və savab vardır.**

**8) (وَمَا لَكُمْ لَا تُؤْمِنُونَ بِاللّٰهِۚ وَالرَّسُولُ يَدْعُوكُمْ لِتُؤْمِنُوا بِرَبِّكُمْ) Sizə nə olubdur ki, Allah-Təalaya iman etmirsiniz, iman etməkdə sizə nə mane olur və nə səbəbiniz vardır? Halbuki peyğəmbərimiz** (Məhəmməd) **sizi dəvət edir ki, rəbbiniz Allah-Təalaya iman edəsiniz. Nədən ötrü belə bir dəvətçinin dəvətini tərk edib, iman etmirsiniz? (وَقَدْ اَخَذَ مٖيثَاقَكُمْ اِنْ كُنْتُمْ مُؤْمِنٖينَ) - Və halbuki Allah-Təalaya iman edib müvəhhid olmaq üçün Allah-Təala sizdən möhkəm əhd alıb,** (sizə ağıl və dəlillər verib, o dəlilləri dərk etmənizə mane olan şeyləri dəf edibdir), **əgər iman edənsinizsə, ağıl dəlili sizə kifayət edər və halbuki buna əlavə olaraq** (Məhəmməd) **kimi peyğəmbər də sizi dəvət edib, qəflət yuxusundan oyandırır, bununla belə yenə iman etmirsiniz.**

**9) (هُوَ الَّذٖي يُنَزِّلُ عَلٰى عَبْدِهٖٓ اٰيَاتٍ بَيِّنَاتٍ لِيُخْرِجَكُمْ مِنَ الظُّلُمَاتِ اِلَى النُّورِۜ) Allah-Təala öz bəndəsi** (Məhəmmədə) **dəlil və sübutu açıq-aşkar olan ayələr** (Qurani-Şərif) **nazil edir ki, Quranın səbəbinə sizi küfr və cəhalət qaranlığından**

وَاِنَّ اللّٰهَ بِكُمْ لَرَؤُ۫فٌ رَح۪يمٌ ﴿٩﴾ وَمَا لَكُمْ اَلَّا تُنْفِقُوا ف۪ي سَب۪يلِ اللّٰهِ وَلِلّٰهِ م۪يرَاثُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ لَا
يَسْتَو۪ي مِنْكُمْ مَنْ اَنْفَقَ مِنْ قَبْلِ الْفَتْحِ وَقَاتَلَۜ اُو۬لٰٓئِكَ اَعْظَمُ دَرَجَةً مِنَ الَّذ۪ينَ اَنْفَقُوا مِنْ بَعْدُ وَقَاتَلُواۜ
وَكُلًّا وَعَدَ اللّٰهُ الْحُسْنٰىۜ وَاللّٰهُ بِمَا تَعْمَلُونَ خَب۪يرٌ ﴿١٠﴾ مَنْ ذَا الَّذ۪ي يُقْرِضُ اللّٰهَ قَرْضًا حَسَنًا فَيُضَاعِفَهُ
لَهُ وَلَهُ اَجْرٌ كَر۪يمٌ ﴿١١﴾ يَوْمَ تَرَى الْمُؤْمِن۪ينَ وَالْمُؤْمِنَاتِ يَسْعٰى نُورُهُمْ بَيْنَ اَيْد۪يهِمْ وَبِاَيْمَانِهِمْ

---

**iman və elm nuruna tərəf çıxarsın. (وَاِنَّ اللّٰهَ بِكُمْ لَرَؤُ۫فٌ رَح۪يمٌ) - Və həqiqətən, Allah-Təala sizlərə mehriban və rəhm edəndir.**

**10) (وَمَا لَكُمْ اَلَّا تُنْفِقُوا ف۪ي سَب۪يلِ اللّٰهِ وَلِلّٰهِ م۪يرَاثُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ) Sizə nə mane olur ki, sizə verdiyi maldan Allah-Təala yolunda xərcləmirsiniz? Halbuki göylərin və yerin və onlarda olan hər bir şeyin mirası Allah-Təalaya məxsusdur. Ölüm sizə də gəlib, mallarınıza Allah-Təala varis olacaqdır. Heç bir şeyi özünüzlə qəbrə aparmayacaqsınız. Bu səbəbdən sizdən ötrü ən yaxşısı Allah yolunda xərcləməkdir.**

**(لَا يَسْتَو۪ي مِنْكُمْ مَنْ اَنْفَقَ مِنْ قَبْلِ الْفَتْحِ وَقَاتَلَ) Sizlərdən o şəxslər ki, islam dini qüvvət və izzət* tapmamış** (Məkkənin fəthindən qabaq) **malından xərcləyib və Allah-Təala yolunda cihad edir, din qüvvət tapıb** (Məkkənin fəthindən) **sonra xərcləyib, cihad edənlər onlarla bərabər olmazlar.**

**( اُو۬لٰٓئِكَ اَعْظَمُ دَرَجَةً مِنَ الَّذ۪ينَ اَنْفَقُوا مِنْ بَعْدُ وَقَاتَلُواۜ) - Məkkə fəthindən qabaq** (Allah yolunda mal) **xərcləyib, cihad edənlərin Allah-Təala yanında dərəcəsi Məkkə fəthindən sonra xərcləyib, cihad edənlərdən daha böyükdür. (وَكُلًّا وَعَدَ اللّٰهُ الْحُسْنٰىۜ) - Məkkə fəthindən əvvəl və sonra mal xərcləyib, cihad edənlərin hər ikisinə Allah-Təala gözəl savab vədi veribdir, lakin savab və dərəcələrində fərq vardır. (وَاللّٰهُ بِمَا تَعْمَلُونَ خَب۪يرٌ) Hər bir əməllərinizə Allah-Təala agah və xəbərdardır.**

(***Qeyd:** *"Bu mübarək surə Məkkədə nazil olubdur. Neçə illərdən sonra, hicrətin 8-ci ilində Məkkə fəth olundu. Bu ayədə hələ Məkkə fəth olunmamış, bunu müjdələmək müsəlmanların əli ilə Məkkənin fəth olunub, müşriklərin zəlil olacağına işarədir. Ta ki, müsəlmanlar və Allahın Rəsulu bu müjdəyə şad olub Məkkənin fəth olunacağına inanıb, bu yolda çalışsınlar).*

**11) (مَنْ ذَا الَّذ۪ي يُقْرِضُ اللّٰهَ قَرْضًا حَسَنًا فَيُضَاعِفَهُ لَهُ وَلَهُ اَجْرٌ كَر۪يمٌ) Kimdir o şəxs ki, malını Allah-Təala yolunda xərcləməklə Allah-Təalaya gözəl şəkildə borc versin, Allah-Təala da o borcu ondan ötrü çoxaldıb artırsın? Ondan başqa da belə şəxsdən ötrü Allah-Təala yanında izzətli və faydalı əcr və muzd vardır.**

**12) (يَوْمَ تَرَى الْمُؤْمِن۪ينَ وَالْمُؤْمِنَاتِ يَسْعٰى نُورُهُمْ بَيْنَ اَيْد۪يهِمْ وَبِاَيْمَانِهِمْ)** - (Ey Məhəmməd), **qiyamət günündə iman edən kişilər və qadınlar gedərkən, əməllərinin**

بُشْرٰيكُمُ الْيَوْمَ جَنَّاتٌ تَجْرٖي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدٖينَ فٖيهَاۜ ذٰلِكَ هُوَ الْفَوْزُ الْعَظٖيمُۚ ﴿١٢﴾ يَوْمَ يَقُولُ الْمُنَافِقُونَ وَالْمُنَافِقَاتُ لِلَّذٖينَ اٰمَنُوا انْظُرُونَا نَقْتَبِسْ مِنْ نُورِكُمْ قٖيلَ ارْجِعُوا وَرَٓاءَكُمْ فَالْتَمِسُوا نُورًاۜ فَضُرِبَ بَيْنَهُمْ بِسُورٍ لَهُ بَابٌۜ بَاطِنُهُ فٖيهِ الرَّحْمَةُ وَظَاهِرُهُ مِنْ قِبَلِهِ الْعَذَابُۜ ﴿١٣﴾ يُنَادُونَهُمْ اَلَمْ نَكُنْ مَعَكُمْۜ قَالُوا بَلٰى وَلٰكِنَّكُمْ فَتَنْتُمْ اَنْفُسَكُمْ وَتَرَبَّصْتُمْ وَارْتَبْتُمْ وَغَرَّتْكُمُ الْاَمَانِيُّ حَتّٰى جَٓاءَ اَمْرُ اللّٰهِ وَغَرَّكُمْ بِاللّٰهِ الْغَرُورُ ﴿١٤﴾

---

**nurları onların qabağında və sağ tərəflərində axıb nur saçdığı halda, onları da o nurun işığında gedən görərsən.**

(بُشْرٰيكُمُ الْيَوْمَ جَنَّاتٌ تَجْرٖي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدٖينَ فٖيهَاۜ ذٰلِكَ هُوَ الْفَوْزُ الْعَظٖيمُ) **- O vaxt onlara deyilər: “O cənnətlər ki, onların qəsrlərinin və ağaclarının altından çaylar axır, belə cənnətlərə daxil olmağa bu günkü gündə sizə müjdə verilir və o cənnətlərdə həmişəlik qalacaqsınız. Belə cənnətlərə daxil olmaq böyük əcr və savaba yetişməkdir.**

**13-14)** (يَوْمَ يَقُولُ الْمُنَافِقُونَ وَالْمُنَافِقَاتُ لِلَّذٖينَ اٰمَنُوا انْظُرُونَا نَقْتَبِسْ مِنْ نُورِكُمْ) (Qiyamət günündə) **dünyada nifaq içində olan kişilər və qadınlar mömінləri cənnətə gedən halda gördükdə onlara xitab edib deyərlər: “Ey mömінlər, bir qədər bizi gözləyib dayanın, ta ki, sizin nurunuzdan bir qədər işıq alaq ki, o nurun səbəbinə biz də sizin kimi əzab qaranlığından xilas olaq.**

(قٖيلَ ارْجِعُوا وَرَٓاءَكُمْ فَالْتَمِسُوا نُورًاۜ) **- O vaxt da mömінlər tərəfindən onlara deyilər: “Geriyə** (dünyaya) **qayıdıb, özünüzdən ötrü nur axtarın, bizim nurdan sizə yetişməz.** (فَضُرِبَ بَيْنَهُمْ بِسُورٍ لَهُ بَابٌۜ بَاطِنُهُ فٖيهِ الرَّحْمَةُ وَظَاهِرُهُ مِنْ قِبَلِهِ الْعَذَابُ) **- Bu söhbətdən sonra mömінlərlə münafiqlər arasında bir divar** (pərdə) **çəkilər, hansı ki, o divarın bircə qapısı olar ki, mömінlər o qapıdan cənnətə daxil olarlar. O divarın içəri tərəfində Allah-Təalanın rəhməti olan cənnət, amma çöl tərəfində əzab** (cəhənnəm) **var.** (يُنَادُونَهُمْ اَلَمْ نَكُنْ مَعَكُمْ) **Elə ki, onların arasına divar çəkildi, münafiqlər mömінləri divarın arxasından çağırıb deyərlər: “Bəs biz dünyada sizinlə birlikdə deyildik və sizinlə bir yerdə, bir məqamda olub, sizinlə xoş rəftar etməmişik? Bu günkü gündə bizə mərhəmət edib, bizdən üz döndərməyin.**

(قَالُوا بَلٰى وَلٰكِنَّكُمْ فَتَنْتُمْ اَنْفُسَكُمْ) **- Mömінlər onların cavabında deyərlər: “Bəli, dünyada bizimlə bərabər olub, bizim kimi əməllər edibsiniz, lakin batində münafiq olduğunuza görə nəfsinizi fitnəyə salıb fəlakətə düçar etdiniz.** (وَتَرَبَّصْتُمْ وَارْتَبْتُمْ وَغَرَّتْكُمُ الْاَمَانِيُّ) **- Mömінlərə hər bir növ bəla və müsibətin yetişməsini gözləyib,** (tövhidə) **şəkk etdiniz, tamah və arzular sizi aldatdı.** (حَتّٰى جَٓاءَ اَمْرُ اللّٰهِ وَغَرَّكُمْ بِاللّٰهِ الْغَرُورُ) **Nifaq halında olduğunuz halda Allah-Təalanın əmri gəlib, ölüm sizi ziyarət etdi. Şeytan** (şəri əmr edən xəbis nəfs) **sizi aldadıb, təkəbbürlənib tövbəsiz dünyadan getdiniz.**

فَالْيَوْمَ لَا يُؤْخَذُ مِنْكُمْ فِدْيَةٌ وَلَا مِنَ الَّذِينَ كَفَرُوا ۚ مَاْوٰيكُمُ النَّارُ ۖ هِيَ مَوْلٰيكُمْ ۖ وَبِئْسَ الْمَصِيرُ ﴿١٥﴾
اَلَمْ يَاْنِ لِلَّذِينَ اٰمَنُوا اَنْ تَخْشَعَ قُلُوبُهُمْ لِذِكْرِ اللّٰهِ وَمَا نَزَلَ مِنَ الْحَقِّ ۙ وَلَا يَكُونُوا كَالَّذِينَ اُوتُوا
الْكِتَابَ مِنْ قَبْلُ فَطَالَ عَلَيْهِمُ الْاَمَدُ فَقَسَتْ قُلُوبُهُمْ ۖ وَكَثِيرٌ مِنْهُمْ فَاسِقُونَ ﴿١٦﴾

---

**15) (فَالْيَوْمَ لَا يُؤْخَذُ مِنْكُمْ فِدْيَةٌ وَلَا مِنَ الَّذِينَ كَفَرُوا) - Bugünkü gündə nə siz münafiqlərdən və nə də kafir və müşriklərdən əvəz alınmaz, ta ki, əvəz verib** (hərçənd əvəz də tapılmaz, əgər bir ehtimal, tapılsa da) **əzabdan xilas olasınız. (مَاْوٰيكُمُ النَّارُ ۖ هِيَ مَوْلٰيكُمْ ۖ وَبِئْسَ الْمَصِيرُ) Sizin mənzil və məqamınız cəhənnəm odudur. Cəhənnəm sizə mənzil olmağa layiqdir və nə pis qayıdılacaq bir yerdir.**

**16) (اَلَمْ يَاْنِ لِلَّذِينَ اٰمَنُوا اَنْ تَخْشَعَ قُلُوبُهُمْ لِذِكْرِ اللّٰهِ وَمَا نَزَلَ مِنَ الْحَقِّ)** - (Ey Məhəmməd), **bəs zahirdə iman edən şəxslərdən ötrü o vaxt yetişməyibdir ki, onların qəlbləri Haqqdan nazil olan** (Qurani-Şərif) **və Allah-Təalanın zikrindən ötrü yumşalıb, qorxub, batində və həqiqətən iman edib, nifaqı tərk etsinlər? Bu Qurani-Şərifin ayələrini düşünsələr də yenə nifaq içində qalırlar, çox təəccüblüdür.**

**(وَلَا يَكُونُوا كَالَّذِينَ اُوتُوا الْكِتَابَ مِنْ قَبْلُ فَطَالَ عَلَيْهِمُ الْاَمَدُ فَقَسَتْ قُلُوبُهُمْ ۖ وَكَثِيرٌ مِنْهُمْ فَاسِقُونَ)** - (Ey Məhəmməd), **Qurana iman edənlər gərək onlardan qabaq özlərinə kitab verilənlər** (yəhudi və xristianlar) **kimi olmasınlar ki, onlara kitab göndərilməsindən uzun zaman keçməsi səbəbi ilə dinlərində ixtilaf edib, nəfsani arzulara tabe olmaqdan qəlbləri qatılaşıb, əksəriyyəti fasiq** (günahkar) **oldular. Quran əhli də onlar kimi olmasın*.**

**(*Qeyd:** *"Allah bizi onlar kimi olmaqdan qorusun! Biz özümüzə Quran əhli deyib, Quranı ancaq ölülər üçün oxuyuruq, lakin nə sözlərinin haqqını yerinə yetirib ədəblə oxumağa riayət edirik, nə də mənasına diqqət etmirik. Əksinə, mənasız danışan, ya da yuxuda şüursuzca sayıqlayan adam kimi oxuyub, Quranın ehkamından heç bir şey dərk etmirik, demək olar ki, onun əsl həqiqəti də bizim aramızda işlədilmir. Həqiqətən də belədir. Müqəddəs kitab əhli olan xristian və yəhudilər öz kitablarına zahirən bizdən çox hörmət edib, nadan və cahillərin əlinə düşüb xarab olmasın deyə gözəl şəkildə çap edib və cildləyib, qoruyurlar. Lakin bizdə Qurani-Şərifi qırxayaq və siçanların zay etdiyi kağızlarda çap edib, aşağı qiymətə satırlar. Və bu səbəbdən cahil uşaqları qoltuqlarında cildinin bir tərəfi cırılan bir Quranla məktəbə (cəhalət yuvasına) gedən görərsən, uşaq bir az böyüyən kimi bəzi atalar 5-6 quruşa bir Quran alıb, ən azından oğlunu bir qadın müəlliməyə tapşırmağı özlərinə vacib sayıb, belə deyirlər: "Buna Yasin surəsini öyrətsən, kifayət edər, heç olmasa öləndən sonra bizdən ötrü bir Yasin oxuyar. Başqa şey lazım deyildir. Bu günkü gündə islam ümmətinin arasında Quranın halı vətənindən didərgin olub, cahil və nadanların əlinə düşən alim bir şəxsin halı kimidir. Bununla belə yenə özümüzə Quran əhli və müsəlman deyirik. Bu*

اِعْلَمُوٓا اَنَّ اللّٰهَ يُحْيِ الْاَرْضَ بَعْدَ مَوْتِهَاۜ قَدْ بَيَّنَّا لَكُمُ الْاٰيَاتِ لَعَلَّكُمْ تَعْقِلُونَ﴿١٧﴾ اِنَّ الْمُصَّدِّقِينَ
وَالْمُصَّدِّقَاتِ وَاَقْرَضُوا اللّٰهَ قَرْضًا حَسَنًا يُضَاعَفُ لَهُمْ وَلَهُمْ اَجْرٌ كَرِيمٌ ﴿١٨﴾ وَالَّذِينَ اٰمَنُوا بِاللّٰهِ
وَرُسُلِهٓ اُولٰٓئِكَ هُمُ الصِّدِّيقُونَۗ وَالشُّهَدَٓاءُ عِنْدَ رَبِّهِمْۜ لَهُمْ اَجْرُهُمْ وَنُورُهُمْۜ وَالَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِاٰيَاتِنَٓا
اُولٰٓئِكَ اَصْحَابُ الْجَحِيمِ ﴿١٩﴾ اِعْلَمُوٓا اَنَّمَا الْحَيٰوةُ الدُّنْيَا لَعِبٌ وَلَهْوٌ وَزِينَةٌ وَتَفَاخُرٌ بَيْنَكُمْ وَتَكَاثُرٌ
فِي الْاَمْوَالِ وَالْاَوْلَادِۜ

---

*işlərin günahı özlərini müsəlmanlara rəis sayanlardadır. Əvvəlcədən Quranı xalqın nəzərindən salmasaydılar, bu hala düşməzdik. Allah-Təala baiskarlardan özü intiqam alsın).*

**17) (اِعْلَمُوٓا اَنَّ اللّٰهَ يُحْيِ الْاَرْضَ بَعْدَ مَوْتِهَاۜ) Ey insanlar, bilin və xəbərdar olun, həqiqətən, Allah-Təala yeri öləndən sonra** (hər bir növ ot quruyandan sonra) dirildər. (Yağış göndərib, otları və gülləri bitirər). **(قَدْ بَيَّنَّا لَكُمُ الْاٰيَاتِ لَعَلَّكُمْ تَعْقِلُونَ) Həqiqətən, sizdən ötrü bizim birliyimizə işarə edən ayələri bəyan etdik. Əlbəttə, gərək ağılla hərəkət edib, tövhidə inanasınız.** (Bu ayə Qurani-Şərifin qəlblərə təsir etməyi barəsində bir məsəldir, necə ki, yağış yerə həyat verir, habelə Qurani-Şərifin uca məzmunu cəhalətlə ölən qəlblərə həyat verib, cəhalətdən xilas edir).

**18) (اِنَّ الْمُصَّدِّقِينَ وَالْمُصَّدِّقَاتِ وَاَقْرَضُوا اللّٰهَ قَرْضًا حَسَنًا يُضَاعَفُ لَهُمْ وَلَهُمْ اَجْرٌ كَرِيمٌ)** - (Ey Məhəmməd), **həqiqətən, Allah-Təala yolunda sədəqə verən kişilər və qadınlar və Allah-Təalaya gözəl şəkildə borc verib, mallarını din və millət yolunda xərcləyənlərin sədəqələrinin qarşılığı Allah-Təala yanında çox olar, ondan əlavə onlardan ötrü Allah-Təala yanında faydalı və bərəkətli əcr və savab vardır.**

**19) (وَالَّذِينَ اٰمَنُوا بِاللّٰهِ وَرُسُلِهٓ اُولٰٓئِكَ هُمُ الصِّدِّيقُونَۗ وَالشُّهَدَٓاءُ عِنْدَ رَبِّهِمْ)** - (Ey Məhəmməd), **o şəxslər ki, Allah-Təalaya və onun peyğəmbərlərinə iman edirlər, onlar öz rəbləri Allah-Təalanın yanında doğrulardan** (və böyük cihad) **edən şəhidlərdən sayılacaqlar. (لَهُمْ اَجْرُهُمْ وَنُورُهُمْ) - Onlardan ötrü əcr və savabları və hidayət nurları hazırdır. (وَالَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِاٰيَاتِنَٓا اُولٰٓئِكَ اَصْحَابُ الْجَحِيمِ) - Və o şəxslər ki, kafir olub bizim tövhid və qüdrətimizə işarə edən ayələrimizi təkzib edirlər, onlar cəhənnəm əhlidirlər ki, əzaba düçar olub xilas olmayacaqlar.**

**20) (اِعْلَمُوٓا اَنَّمَا الْحَيٰوةُ الدُّنْيَا لَعِبٌ وَلَهْوٌ وَزِينَةٌ وَتَفَاخُرٌ بَيْنَكُمْ وَتَكَاثُرٌ فِي الْاَمْوَالِ وَالْاَوْلَادِۜ) Ey insanlar, bilin və xəbərdar olun ki, həqiqətən, dünya həyatı tez başa gəlib fani olmaqda həqir bir oyun və boş söz kimi bir şey, müvəqqəti dünya mənfəətini zinət sayıb, aranızda onlarla iftixar etdiyiniz, mal və övladınızı çoxaltma arzusundan ibarətdir. Bunlar hamısı tez fani olandır.**

كَمَثَلِ غَيْثٍ اَعْجَبَ الْكُفَّارَ نَبَاتُهُ ثُمَّ يَهِيجُ فَتَرٰيهُ مُصْفَرًّا ثُمَّ يَكُونُ حُطَامًا وَفِي الْاٰخِرَةِ عَذَابٌ شَدٖيدٌ ۙ
وَمَغْفِرَةٌ مِنَ اللّٰهِ وَرِضْوَانٌ ؕ وَمَا الْحَيٰوةُ الدُّنْيَٓا اِلَّا مَتَاعُ الْغُرُورِ ﴿٢٠﴾ سَابِقُوٓا اِلٰى مَغْفِرَةٍ مِنْ رَبِّكُمْ
وَجَنَّةٍ عَرْضُهَا كَعَرْضِ السَّمَٓاءِ وَالْاَرْضِ ۙ اُعِدَّتْ لِلَّذٖينَ اٰمَنُوا بِاللّٰهِ وَرُسُلِهٖ ؕ ذٰلِكَ فَضْلُ اللّٰهِ يُؤْتٖيهِ مَنْ
يَشَٓاءُ ؕ وَاللّٰهُ ذُو الْفَضْلِ الْعَظٖيمِ ﴿٢١﴾ مَٓا اَصَابَ مِنْ مُصٖيبَةٍ فِي الْاَرْضِ وَلَا فٖٓي اَنْفُسِكُمْ اِلَّا فٖي
كِتَابٍ مِنْ قَبْلِ اَنْ نَبْرَاَهَا ؕ اِنَّ ذٰلِكَ عَلَى اللّٰهِ يَسٖيرٌ ۚ ﴿٢٢﴾ لِكَيْلَا تَأْسَوْا عَلٰى مَا فَاتَكُمْ وَلَا تَفْرَحُوا
بِمَٓا اٰتٰيكُمْ ؕ

---

(كَمَثَلِ غَيْثٍ اَعْجَبَ الْكُفَّارَ نَبَاتُهُ ثُمَّ يَهِيجُ فَتَرٰيهُ مُصْفَرًّا ثُمَّ يَكُونُ حُطَامًا) **- Dünyanın həyatı bir yağış kimidir ki, o yağış səbəbi ilə bitən bitki Allah-Təalanın nemətlərini inkar edən kafirləri təəccübə gətirər. Təptəzəliyindən sonra onu quruyub, saralmış görərsən, ondan sonra dağılıb, yox olarlar, dünya həyatının halı belədir. Belə bir fəna şeylə təkəbbürlənib, xəbis olan sifətlərə bürünmək nadanlıqdır.** (وَفِي الْاٰخِرَةِ عَذَابٌ شَدٖيدٌ ۙ وَمَغْفِرَةٌ مِنَ اللّٰهِ وَرِضْوَانٌ) **Amma axirət böyük işlərdən ibarətdir. Axirətdə asilərə şiddətli əzab və möminlərə Allah-Təaladan bağışlanmaq və məmnunluq vardır.** (وَمَا الْحَيٰوةُ الدُّنْيَٓا اِلَّا مَتَاعُ الْغُرُورِ) **- Dünya həyatı aldadıcı və təkəbbürləndirən bir mənfəətdən başqa bir şey deyil.** (Şəri əmr edən xəbis nəfsə tabe olub, nəfsin hər bir arzusunu yerinə yetirmək təkəbbürlü şəxslərin əməlidir. Ağıllı şəxslər özlərinin və millətlərinin xeyrini və faydasını düşünərək, dünya işlərinə yönələrlər, o vaxt da müvəqqəti dünya həyatı onların axirəti üçün mənfəət yeri olar).

**21)** (سَابِقُوٓا اِلٰى مَغْفِرَةٍ مِنْ رَبِّكُمْ وَجَنَّةٍ عَرْضُهَا كَعَرْضِ السَّمَٓاءِ وَالْاَرْضِ ۙ) **Ey möminlər, rəbbiniz Allah-Təala tərəfindən bağışlanmağa və genişliyi göy və yer qədər olan cənnət üçün bir-birinizlə yarışıb, qabağa keçməyə çalışın.** (اُعِدَّتْ لِلَّذٖينَ اٰمَنُوا بِاللّٰهِ وَرُسُلِهٖ ؕ ذٰلِكَ فَضْلُ اللّٰهِ يُؤْتٖيهِ مَنْ يَشَٓاءُ ؕ وَاللّٰهُ ذُو الْفَضْلِ الْعَظٖيمِ) **- Belə cənnət Allah-Təala və onun peyğəmbərinə iman edənlərdən ötrü hazırlanıbdır. Bu cənnət Allah-Təalanın bir lütfüdür. Onu istədiyinə (möminlərə) verər. Allah-Təala böyük lütf və rəhmət sahibidir.**

**22)** (مَٓا اَصَابَ مِنْ مُصٖيبَةٍ فِي الْاَرْضِ وَلَا فٖٓي اَنْفُسِكُمْ اِلَّا فٖي كِتَابٍ مِنْ قَبْلِ اَنْ نَبْرَاَهَا) **Yer üzündə heç bir müsibət (qəhətlik və əkinlərə zərər dəyməsi) və sizə yetişən heç bir bəla** (xəstəlik və ölüm) **yoxdur ki, biz onu yaratmadan əvvəl "lövhi-məhfuz"da qeyd olunmasın. O, dəyişən də deyildir.** (اِنَّ ذٰلِكَ عَلَى اللّٰهِ يَسٖيرٌ) **- Bunları təqdir edib "lövhi-məhfuz"da qeyd etmək Allah-Təala üçün asandır. Heç bir şey onun qüdrətindən kənar ola bilməz.**

**23)** (لِكَيْلَا تَأْسَوْا عَلٰى مَا فَاتَكُمْ وَلَا تَفْرَحُوا بِمَٓا اٰتٰيكُمْ) **Hər bir şeyin Allah-Təalanın qüdrətində olmağını sizdən ötrü bəyan edir ki, dünyada yox olan, itirdiyiniz şeylərə məhzun olmayıb və sizə gələn şeylərə də şad olmayasınız,**

وَاللّٰهُ لَا يُحِبُّ كُلَّ مُخْتَالٍ فَخُورٍۙ ﴿٢٣﴾ اَلَّذِينَ يَبْخَلُونَ وَيَاْمُرُونَ النَّاسَ بِالْبُخْلِۜ وَمَنْ يَتَوَلَّ فَاِنَّ اللّٰهَ هُوَ الْغَنِيُّ الْحَمِيدُ ﴿٢٤﴾ لَقَدْ اَرْسَلْنَا رُسُلَنَا بِالْبَيِّنَاتِ وَاَنْزَلْنَا مَعَهُمُ الْكِتَابَ وَالْمِيزَانَ لِيَقُومَ النَّاسُ بِالْقِسْطِۚ وَاَنْزَلْنَا الْحَدِيدَ فِيهِ بَاْسٌ شَدِيدٌ وَمَنَافِعُ لِلنَّاسِ وَلِيَعْلَمَ اللّٰهُ مَنْ يَنْصُرُهُ وَرُسُلَهُ بِالْغَيْبِۜ اِنَّ اللّٰهَ قَوِيٌّ عَزِيزٌۚ ﴿٢٥﴾ وَلَقَدْ اَرْسَلْنَا نُوحًا وَاِبْرٰهِيمَ وَجَعَلْنَا فِي ذُرِّيَّتِهِمَا النُّبُوَّةَ وَالْكِتَابَ فَمِنْهُمْ مُهْتَدٍۚ وَكَثِيرٌ مِنْهُمْ فَاسِقُونَ ﴿٢٦﴾

---

**dünyanın olub olmamağı, nemət və müsibəti sizdən ötrü eyni olub, hamısını Allah-Təalaya həvalə edəsiniz, nemət vaxtı təkəbbürlənib, müsibət vaxtı da fəryad etməyəsiniz. (وَاللّٰهُ لَا يُحِبُّ كُلَّ مُخْتَالٍ فَخُورٍۙ) - Dünya nemətlərinə sevinib, təkəbbürlənənlərin heç birini Allah-Təala sevməz.**

**24) (اَلَّذِينَ يَبْخَلُونَ وَيَاْمُرُونَ النَّاسَ بِالْبُخْلِۜ) Təkəbbürlənənlərin sifətləri budur ki, özləri xəsislik etməkdən başqa, insanlara da xəsisliyi əmr edərlər. Belə şəxsləri əlbəttə Allah-Təala sevməz. (وَمَنْ يَتَوَلَّ فَاِنَّ اللّٰهَ هُوَ الْغَنِيُّ الْحَمِيدُ) - Və kim ki, Allah-Təalanın əmr və qadağasından üz döndərib, itaət etməsə, həqiqətən, Allah-Təala onun itaətinə möhtac deyildir və hər bir feilində və əməlində Allah-Təala bəyənilmişdir.**

**25) (لَقَدْ اَرْسَلْنَا رُسُلَنَا بِالْبَيِّنَاتِ وَاَنْزَلْنَا مَعَهُمُ الْكِتَابَ وَالْمِيزَانَ لِيَقُومَ النَّاسُ بِالْقِسْطِۚ)** - (Ey Məhəmməd), **həqiqətən, biz peyğəmbərlərimizi onların doğruluğuna işarə edən dəlil və sübutlarla göndərdik və onlarla birlikdə kitab və ədalət ölçüsünü göndərib, ona əməl etməyi əmr etdik ki, insanlar bir-biri ilə ədalətlə rəftar edib, heç kim digərinə zülm etməsin.**

**(وَاَنْزَلْنَا الْحَدِيدَ فِيهِ بَاْسٌ شَدِيدٌ وَمَنَافِعُ لِلنَّاسِ)** - (Ey Məhəmməd), **dəmiri yaradıb, insanlardan ötrü verdik. Dəmirdə şiddətli qüvvət və insanlardan ötrü mənfəətlər vardır.** (Zəmanədən agah olan şəxslərə dəmirdə olan qüvvə və mənfəət və onların elm səbəbi ilə zühura gəlməsi gizli deyildir, zamanın keçməsi ilə sənaye inkişaf etdikcə, dəmirdən zühura gələn mənfəətlərə bundan əvvəl Qurani-Şərifdə də işarə edilməsi Qurani-Şərifin fəsahət və bəlağətinə və möcüzə olmasına kifayət etməzmi?) **(وَلِيَعْلَمَ اللّٰهُ مَنْ يَنْصُرُهُ وَرُسُلَهُ بِالْغَيْبِ)** - (Ey Məhəmməd), **peyğəmbərləri göndərib qeyd olunan şeyləri göndərdik ki, xalq bir-biri ilə həm ədalət üzrə rəftar etsin, həm də Allah-Təala özünə və peyğəmbərlərinə gizlincə kömək edənləri etməyənlərdən ayırıb ortaya çıxartsın. (اِنَّ اللّٰهَ قَوِيٌّ عَزِيزٌ) Həqiqətən, Allah-Təala hər bir işində qüvvət sahibi və məxluqata agahdır.**

**26) (وَلَقَدْ اَرْسَلْنَا نُوحًا وَاِبْرٰهِيمَ وَجَعَلْنَا فِي ذُرِّيَّتِهِمَا النُّبُوَّةَ وَالْكِتَابَ)** - (Ey Məhəmməd), **həqiqətən, Nuh və İbrahimi insanlara peyğəmbər göndərib, onların övladlarına da peyğəmbərlik və kitab verdik. (فَمِنْهُمْ مُهْتَدٍ وَكَثِيرٌ مِنْهُمْ فَاسِقُونَ) Lakin peyğəmbər göndərilənlərin bəzisi hidayət tapdı, əksəriyyəti fasiq oldular.**

ثُمَّ قَفَّيْنَا عَلٰى اٰثَارِهِمْ بِرُسُلِنَا وَقَفَّيْنَا بِعِيسَى ابْنِ مَرْيَمَ وَاٰتَيْنَاهُ الْاِنْجِيلَ وَجَعَلْنَا فِي قُلُوبِ الَّذِينَ
اتَّبَعُوهُ رَاْفَةً وَرَحْمَةً ۜ وَرَهْبَانِيَّةً ابْتَدَعُوهَا مَا كَتَبْنَاهَا عَلَيْهِمْ اِلَّا ابْتِغَاۤءَ رِضْوَانِ اللّٰهِ فَمَا رَعَوْهَا حَقَّ
رِعَايَتِهَا ۚ فَاٰتَيْنَا الَّذِينَ اٰمَنُوا مِنْهُمْ اَجْرَهُمْ ۚ وَكَثِيرٌ مِنْهُمْ فَاسِقُونَ ﴿٢٧﴾ يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا اتَّقُوا اللّٰهَ
وَاٰمِنُوا بِرَسُولِهِ يُؤْتِكُمْ كِفْلَيْنِ مِنْ رَحْمَتِهِ وَيَجْعَلْ لَكُمْ نُورًا تَمْشُونَ بِهِ وَيَغْفِرْ لَكُمْ ۜ وَاللّٰهُ غَفُورٌ رَحِيمٌ
﴿٢٨﴾ لِئَلَّا يَعْلَمَ اَهْلُ الْكِتَابِ اَلَّا يَقْدِرُونَ عَلٰى شَيْءٍ مِنْ فَضْلِ اللّٰهِ

---

**27)** (ثُمَّ قَفَّيْنَا عَلٰى اٰثَارِهِمْ بِرُسُلِنَا) **Qeyd olunan peyğəmbərlərin əsərlərinə peyğəmbərlərimizi tabe edib bir-birinin arxasınca göndərdik.**

(وَقَفَّيْنَا بِعِيسَى ابْنِ مَرْيَمَ) **Ta ki, növbə İsaya yetişib, İsa Məryəm oğlunu onların arxasınca peyğəmbər göndərdik.**

(وَاٰتَيْنَاهُ الْاِنْجِيلَ وَجَعَلْنَا فِي قُلُوبِ الَّذِينَ اتَّبَعُوهُ رَاْفَةً وَرَحْمَةً) **- İsa Məryəm oğluna** (kitab) **"İncil" verib ona tabe olanların qəlblərinə rəhm və mehribanlıq saldıq ki, bir-birlərini sevsinlər.** (وَرَهْبَانِيَّةً ابْتَدَعُوهَا مَا كَتَبْنَاهَا عَلَيْهِمْ) **- İsa ümməti özlərindən rahiblik çıxarıb, dünyanı tərk edib, dağlarda və və mağaralarda ibadətə məşğul oldular. Hansı ki, rahibliyi biz onlara vacib etməmişdik.** (اِلَّا ابْتِغَاۤءَ رِضْوَانِ اللّٰهِ فَمَا رَعَوْهَا حَقَّ رِعَايَتِهَا) **- Əksinə onlar özləri Allah-Təalanın məmnunluğunu qazanmaqdan ötrü rahibliyi ortaya çıxartdılar. Lakin rahibliyin haqqına da riayət etməyib, zay etdilər.**

(فَاٰتَيْنَا الَّذِينَ اٰمَنُوا مِنْهُمْ اَجْرَهُمْ ۚ وَكَثِيرٌ مِنْهُمْ فَاسِقُونَ) **- İsaya tabe olub, iman edənlərə əcr və savablarını verdik, lakin onların əksəriyyəti dinin ehkamını mühafizə etməyib, fasiq oldular.**

**28)** (يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا اتَّقُوا اللّٰهَ وَاٰمِنُوا بِرَسُولِهِ يُؤْتِكُمْ كِفْلَيْنِ مِنْ رَحْمَتِهِ) **Ey Allah-Təalaya iman edən** (Tövrat və İncil) **əhli, Allah-Təaladan qorxub, onun peyğəmbərinə** (Məhəmmədə) **iman edin ki, imanınız kamil olsun. İmanınız kamil olduqda, Allah-Təala öz rəhmətindən sizə iki hissə bəxş edər.** (وَيَجْعَلْ لَكُمْ نُورًا تَمْشُونَ بِهِ وَيَغْفِرْ لَكُمْ) **- Və sizə* elə bir nur verər ki, o nurun səbəbi ilə yer üzündə gedib, insanlar sizə tabe olarlar və axirətdə də sizi bağışlayar.** (وَاللّٰهُ غَفُورٌ رَحِيمٌ) **Allah-Təala özünə iman edənlərə rəhm edib, onları bağışlayandır.**

(***Qeyd:** *"Ayədəki nur elmdən ibarət olduğuna görə elm sahibləri yer üzündə gərək nurlu varlıq kimi hərəkət etsinlər. O halda insanların onlara tabe olması üçün heç bir dəlilə ehtiyac qalmayıb, bu dəlillər günəş kimi zahir olar. Elm əhlinə müjdə olsun).*

**29)** (لِئَلَّا يَعْلَمَ اَهْلُ الْكِتَابِ اَلَّا يَقْدِرُونَ عَلٰى شَيْءٍ مِنْ فَضْلِ اللّٰهِ) **Allah-Təala digər peyğəmbərlər ilə** (Məhəmmədə) **iman edənlərə rəhmətindən iki hissə verib, onlara elə bir nur** (elm) **bəxş edər ki, kitab əhli** (xristian və yəhudilər)

وَاَنَّ الْفَضْلَ بِيَدِ اللّٰهِ يُؤْتِيهِ مَنْ يَشَٓاءُ ۜ وَاللّٰهُ ذُو الْفَضْلِ الْعَظِيمِ ﴿٢٩﴾

---

**agah olsun ki, həqiqətən, Allah-Təalanın özünün bəxş etdiyi lütf və rəhmətindən başqa heç bir şeyə qadir ola bilməzlər.**

**(وَاَنَّ الْفَضْلَ بِيَدِ اللّٰهِ يُؤْتِيهِ مَنْ يَشَٓاءُ ۜ وَاللّٰهُ ذُو الْفَضْلِ الْعَظِيمِ) - Və həqiqətən, lütf və rəhmət Allah-Təalanın qüdrətinə tabedir, istədiyinə bəxş edər və Allah-Təala böyük lütf və mərhəmət sahibidir.**

**Allaha həmd olsun, əl-Hədid surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: "Kim əl-Hədid surəsini oxusa, Allah-Təala və onun peyğəmbərlərinə iman edənlərdən hesab olunar. Bu mübarək surə elm və sənayenin tərəqqisinə və sənayenin öyrənilməsinin vacibliyinə işarə edən ayəni ehtiva edir. Diqqət etmək lazımdır.**

# əl-MÜCADƏLƏ SURƏSİ

58-ci surədir. Mədinədə nazil olub, 22 ayə, 473 kəlmə və 1792 hərfdir.

قَدْ سَمِعَ اللّٰهُ قَوْلَ الَّتِي تُجَادِلُكَ فِي زَوْجِهَا وَتَشْتَكِيٓ اِلَى اللّٰهِ وَاللّٰهُ يَسْمَعُ تَحَاوُرَكُمَاۜ اِنَّ اللّٰهَ سَمِيعٌ بَصِيرٌ ﴿١﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

(Mədinədə ənsardan Evs ibn Samitin xanımı Xavlə Sələbə qızı gözəl üzlü və ətli-canlı bir qadın idi. Namazla məşğul ikən əri Evs ona baxıb, onu arzuladı. Namazı qılandan sonra əri Evs ona yaxınlaşmaq istədi. Xavlə isə razı olmayıb imtina etdi. Evs qəzəblənib cahiliyyə talağı* ("zihar") **adəti ilə ona talaq verdi. Ondan sonra peşman oldu.**

**(*Qeyd:** *"Cahiliyyə zamanında əgər bir şəxs xanımına desəydi ki, "sən mənə anamın arxası kimisən", yəni necə ki, anam mənə haramdır, sən də mənə haram oldun, bu sözə "zihar" deyib, xanımı özlərinə haram sayardılar. Bu surədə zihar ilə xanımın haram sayılması qadağan olunub, bunu edənə kəffarə cəzası verildi. Kəffarənin nə olması ayədə bəyan edilir).*

*Xavlə peyğəmbərin hüzuruna gedib ərz etdi: "Ey peyğəmbər, mən cavan, gözəl üzlü bir qadın olub, hər kəs məni istərkən, Evs mənimlə evləndi. İndi isə yaşım keçib, övladım çoxaldığı bir halda məni özünə ana kimi sayıb, məni özünə haram etdi. Mənim balaca balalarım var, əgər ona tapşırsam məhv olarlar. Ya əgər özümlə aparsam, ac qalarlar. "Ey peyğəmbər, mənə bir çarə tap. O cənab buyurdu: "Ərinə haram oldun. Ərz etdi: "Ey peyğəmbər, and olsun Allah-Təalaya ki, talaq sözünü deməyib, özü övladlarımın atasıdır, hamıdan artıq mən onu sevirəm. Peyğəmbər buyurdu: "Haram oldun. Xavlə peyğəmbərlə mübahisə edib, hər dəfə peyğəmbər ona deyəndə ki, haram oldun, ah çəkib, nalə və fəryad edib deyirdi: şikayətimi Allah-Təalaya edirəm, o vaxt da bu əl-Mücadələ" surəsi nazil oldu. Bir neçə ayəsi "zihar" barəsindədir, "zihar"ın talaq sayılması qadağan olundu. Lakin "zihar" edən şəxsin "zihar"dan sonra xanımına yaxınlaşmamış gərək "kəffarə" (dini cəza) ödəyib, ondan sonra yaxınlaşmasının vacibliyi ayələrdə bəyan olundu. Necə ki, bu mübarək surədə qeyd olunur).*

**1) (قَدْ سَمِعَ اللّٰهُ قَوْلَ الَّتِي تُجَادِلُكَ فِي زَوْجِهَا وَتَشْتَكِيٓ اِلَى اللّٰهِ)** - (Ey Məhəmməd), **o qadın ki,** (Xavlə) **ərinin** (Evs) **ona zihar etməsi haqqında səninlə mübahisə edib, Allah-Təalaya şikayət edirdi, həqiqətən, Allah-Təala onun sözünü eşitdi. (وَاللّٰهُ يَسْمَعُ تَحَاوُرَكُمَاۜ اِنَّ اللّٰهَ سَمِيعٌ بَصِيرٌ)** - (Ey Məhəmməd), **sizin bir-birinizə söz deməniz Allah-Təala eşidir, həqiqətən, Allah-Təala şikayət edənlərin kəlamını və yalvarışını eşidib, onların əhvalını görüb və xəbərdardır.**

اَلَّذٖينَ يُظَاهِرُونَ مِنْكُمْ مِنْ نِسَآئِهِمْ مَا هُنَّ اُمَّهَاتِهِمْۜ اِنْ اُمَّهَاتُهُمْ اِلَّا الّٰٓئٖي وَلَدْنَهُمْۜ وَاِنَّهُمْ لَيَقُولُونَ
مُنْكَرًا مِنَ الْقَوْلِ وَزُورًاۜ وَاِنَّ اللّٰهَ لَعَفُوٌّ غَفُورٌ ﴿٢﴾ وَالَّذٖينَ يُظَاهِرُونَ مِنْ نِسَآئِهِمْ ثُمَّ يَعُودُونَ لِمَا
قَالُوا فَتَحْرٖيرُ رَقَبَةٍ مِنْ قَبْلِ اَنْ يَتَمَآسَّاۜ ذٰلِكُمْ تُوعَظُونَ بِهٖۜ وَاللّٰهُ بِمَا تَعْمَلُونَ خَبٖيرٌ ﴿٣﴾ فَمَنْ لَمْ يَجِدْ
فَصِيَامُ شَهْرَيْنِ مُتَتَابِعَيْنِ مِنْ قَبْلِ اَنْ يَتَمَآسَّاۚ فَمَنْ لَمْ يَسْتَطِعْ فَاِطْعَامُ سِتّٖينَ مِسْكٖينًاۜ ذٰلِكَ لِتُؤْمِنُوا بِاللّٰهِ
وَرَسُولِهٖۜ وَتِلْكَ حُدُودُ اللّٰهِۜ وَلِلْكَافِرٖينَ عَذَابٌ اَلٖيمٌ ﴿٤﴾

---

**2) (اَلَّذٖينَ يُظَاهِرُونَ مِنْكُمْ مِنْ نِسَآئِهِمْ مَا هُنَّ اُمَّهَاتِهِمْۜ)** - (Ey Məhəmməd), **o şəxslər ki sizlərdən öz qadınlarını "zihar" edirlər,** (yəni xanımlarına deyirlər: "Sən mənə anamın arxası kimisən) **və onları analarına oxşadırlar, o qadınlar onların anası deyildir. O kəlamı deməklə qadınlar onlara ana olmaz. (اِنْ اُمَّهَاتُهُمْ اِلَّا الّٰٓئٖي وَلَدْنَهُمْۜ وَاِنَّهُمْ لَيَقُولُونَ مُنْكَرًا مِنَ الْقَوْلِ وَزُورًاۜ وَاِنَّ اللّٰهَ لَعَفُوٌّ غَفُورٌ) - Onları doğan qadınlardan başqa heç bir qadın onların həqiqi anası deyildir. Onlardan başqa heç bir qadın bir şəxsin həqiqi anası olmaz. Qadını anaya oxşatmaqla o xanım ona haram olmaz. Həqiqətən, kişilər xanımlarına "zihar" etməklə çirkin və haqdan uzaq yalan bir söz deyirlər və həqiqətən, Allah-Təala o sözdən tövbə edənləri bağışlayıb, güzəşt edəndir.**

**3) (وَالَّذٖينَ يُظَاهِرُونَ مِنْ نِسَآئِهِمْ ثُمَّ يَعُودُونَ لِمَا قَالُوا فَتَحْرٖيرُ رَقَبَةٍ مِنْ قَبْلِ اَنْ يَتَمَآسَّاۜ)** - (Ey Məhəmməd), **ziharın hökmü budur ki, qeyd olunur: "O şəxslər ki, qadınlarını zihar edib, özlərinə haram edirlər, ondan sonra peşman olub dedikləri sözlərdən qayıtsalar, ər və qadın bir-birinə yaxınlaşmamış gərək zihar edən kişi bir qulam azad etsin. Ondan sonra xanımı ilə yaxınlaşmaq ona halal olar. (ذٰلِكُمْ تُوعَظُونَ بِهٖۜ وَاللّٰهُ بِمَا تَعْمَلُونَ خَبٖيرٌ) Sizlərə bu hökmlə nəsihət olunur ki, belə çirkin işi** (ziharı) **tərk edib, ona yönəlməyəsiniz, hər bir əməl ki, edirsiniz, Allah ona agah və xəbərdardır.**

**4) (فَمَنْ لَمْ يَجِدْ فَصِيَامُ شَهْرَيْنِ مُتَتَابِعَيْنِ مِنْ قَبْلِ اَنْ يَتَمَآسَّاۚ) - Və kim ki** (zihar) **edəndən sonra kəffarə verməkdən ötrü azad etməyə qulam tapmasa, gərək o şəxs** (xanımına) **yaxınlaşmadan** (əlaqədən) **əvvəl bir-birinin arxasınca tam iki ay oruc tutsun. (فَمَنْ لَمْ يَسْتَطِعْ فَاِطْعَامُ سِتّٖينَ مِسْكٖينًاۜ) - Və kim ki, kəffarə verməkdən ötrü oruc tutmağa qüdrəti olmayıb, ac qalmaq ona çətin olsa, gərək o şəxs altmış nəfər kasıba yemək versin, ondan sonra xanımına yaxınlaşmaq ona halal olar. (ذٰلِكَ لِتُؤْمِنُوا بِاللّٰهِ وَرَسُولِهٖ) Allah-Təalanın hər bir hökmü sizdən ötrü belə bəyan edib, təlim etməsi ondan ötrüdür ki, şəriət hökmlərinə əməl edib, cahiliyyə hökmlərini tərk etməkdə Allah-Təalaya və onun peyğəmbərinə iman edib, tabe olasınız* və zihar kimi çirkin əməllərə qurşanmayasınız. (وَتِلْكَ حُدُودُ اللّٰهِۜ وَلِلْكَافِرٖينَ عَذَابٌ اَلٖيمٌ) - Bu qeyd olunan hökmlər Allah-Təalanın hədləridir. Onlarda həddi aşmaq olmaz. Belə hədləri aşıb, əməl etməyən kafirlərdən ötrü axirətdə əziyyət verən əzab vardır. Zihar barəsində nazil olan ayələr tamamlandı.**

**(*Qeyd:** *Zihar məsələsində necə ki, şəxs öz xanımı anasına oxşadanda ona haram olursa, habelə digər məhrəm qadınlara (qız, bacı) da oxşadanda haram olar. Ziharda bir neçə şərt mövcud olmalıdır ki, zihar reallaşsın. Əvvəlcə zihar talaq kimi iki nəfər adil şəxsin hüzurunda gərək olsun (Tusi, Təhzib, VIII/11) və ikincisi - qadın aybaşı xəstəliyindən gərək pak olsun (Tusi, Təhzib, VIII/14) və üçüncüsü - zihar edən şəxs gərək ağıllı, yetkin və zihar niyyətində olsun. Əgər bu şərtlərin biri mövcud olmasa zihar vaqe olmayıb (Tusi, Təhzib, VIII/14), kəffarə də vermək lazım olmayacaqdır. İmam Əbu Hənifə və onun davamçıları, habelə Həsən Bəsri, Nəhayi, Zühri, Əvzai, Sevri (Qurtubi, Təfsir, XVII, 177) və İmami şiələrinin əksəriyyəti deyib ki, xanımı anadan başqa məhrəmlərə də oxşadanda zihar vaqe olur. . (Kuleyni, Kafi (Furu), II/127; Tusi, Təhzib, VIII/9; İstibsar, III/258) Necə ki, qeyd olundu, lakin imam Şafei, Qətadə, Şə`bi xanımı anadan başqasına oxşadanda ziharın vaqe olmadığı haqqında fətva veriblər. Şə`bi deyibdir: "O yerdə ki, Allah-Təala zihar etməkdə anaları qeyd edir, qızları, bacıları, bibiləri, xalaları unutmayıbdır. Əksinə onlara oxşadanda ziharın vaqe olmadığına görə onları qeyd etməyibdir. Bu alimlər ancaq ayənin zahirinə bağlanıb, fətva veriblər. Ziharın kəffarəsi necə ki, qeyd olundu, eynilə Ramazan ayının kəffarəsidir. Ancaq Ramazan ayında iftar edən şəxs üç kəffarənin arasında azaddır, amma ziharda əvvəlcə qulam azad etmək, əgər mümkün olmasa oruc tutmaq, əgər oruc tuta bilməsə, o zaman altmış yoxsula yemək vermək lazımdır. Peyğəmbərin səhabələrindən Sələmə ibn Səxr Bəyazi belə deyib: "Mən cinsi əlaqəyə çox həris bir kişi idim, elə ki, mübarək Ramazan ayı daxil oldu, xanıma yaxınlaşmaqdan qorxub, bir ay Ramazan bitincəyə qədər xanıma zihar etdim. Mehtablı bir gecədə xanım mənə xidmət edərkən, xanımın ayağqlarındakı bilərziyi gördüm, özümü saxlaya bilməyib, ona yaxınlaşdım. Səhər olunca qohumlarıma xəbər verib dedim: "Gəlin mənimlə peyğəmbərin hüzuruna gedək, mənimlə heç biri gəlmədi, mən özüm peyğəmbərin hüzuruna gedib, əhvalatı nəql etdim. Buyurdu: "Belə bir əməl səndən əmələ gəlib? Dedim: "Bəli, amma Allah-Təalanın əmrinə hazıram. Buyurdu: "Elə isə bir boyun, yəni bir qulam azad et. Əlimi boynuma vurub dedim: "Ey peyğəmbər, bundan başqa boyuna malik deyiləm. Buyurdu: "İki ay oruc tut. Dedim: "Ey peyğəmbər, mənim başıma bu bəla orucdan gəlmədimi? Buyurdu: "Altmış nəfər yoxsula yeməsi üçün xurma ver. Dedim: "Ey peyğəmbər, and olsun Allah-Təalaya ki, səni haqq peyğəmbər göndərib, yoxsullara verməyə yeməyim yoxdur. Buyurdu: "Bəni-Rüzeyq camaatının zəkatını yığan şəxsin yanına gedib de ki, o zəkatı sənə versin ki, altmış nəfər yoxsula kəffarə verəsən. Qalanını özün və ailən ye. Gedib zəkatı alıb sərf etdi. Bir başqa rəvayət də belədir. Dedim: "Ey peyğəmbər, o zəkatı alıb özümdən yoxsul şəxslərə verim? Peyğəmbər təbəssüm etdi, gedib zəkatı alıb özünə sərf etdi).*

**5) (اِنَّ الَّذِينَ يُحَآدُّونَ اللهَ وَرَسُولَهُ كُبِتُوا كَمَا كُبِتَ الَّذِينَ مِنْ قَبْلِهِمْ)** - (Ey Məhəmməd), **həqiqətən, o şəxslər ki, Allah-Təalanı və onun peyğəmbərini** (Məhəmmədi)

وَقَدْ اَنْزَلْنَٓا اٰيَاتٍ بَيِّنَاتٍۜ وَلِلْكَافِرِينَ عَذَابٌ مُهِينٌۚ ﴿٥﴾ يَوْمَ يَبْعَثُهُمُ اللّٰهُ جَمِيعًا فَيُنَبِّئُهُمْ بِمَا عَمِلُواۜ
اَحْصٰيهُ اللّٰهُ وَنَسُوهُۜ وَاللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ شَهِيدٌۚ ﴿٦﴾ اَلَمْ تَرَ اَنَّ اللّٰهَ يَعْلَمُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي
الْاَرْضِۜ مَا يَكُونُ مِنْ نَجْوٰى ثَلٰثَةٍ اِلَّا هُوَ رَابِعُهُمْ وَلَا خَمْسَةٍ اِلَّا هُوَ سَادِسُهُمْ وَلَٓا اَدْنٰى مِنْ ذٰلِكَ
وَلَا اَكْثَرَ اِلَّا هُوَ مَعَهُمْ اَيْنَ مَا كَانُواۚ ثُمَّ يُنَبِّئُهُمْ بِمَا عَمِلُوا يَوْمَ الْقِيٰمَةِۜ اِنَّ اللّٰهَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ ﴿٧﴾
اَلَمْ تَرَ اِلَى الَّذٖينَ نُهُوا عَنِ النَّجْوٰى ثُمَّ يَعُودُونَ لِمَا نُهُوا عَنْهُ

---

**düşmən sayıb, onların əmrinə itaət etmirlər, Allah-Təala onları zəlil və həlak edər. Necə ki, onlardan əvvəlki din düşmənlərini zəlil və həlak etdi. (وَقَدْ اَنْزَلْنَٓا اٰيَاتٍ بَيِّنَاتٍ) - Və halbuki həqiqətən, biz peyğəmbərin doğruluğuna açıq-aşkar işarə edən dəlil və sübutları göndərdik. Bununla belə o dəlillərə baxmayıb kafir oldular. (وَلِلْكَافِرِينَ عَذَابٌ مُهِينٌ) - O dəlil və sübutları inkar edən kafirlərdən ötrü onları zəlil edib, izzətlərini yox edən əzab vardır.** (Necə ki, oldu).

**6) (يَوْمَ يَبْعَثُهُمُ اللّٰهُ جَمِيعًا فَيُنَبِّئُهُمْ بِمَا عَمِلُواۜ اَحْصٰيهُ اللّٰهُ وَنَسُوهُ) Ey Məhəmməd, o gündə ki,** (qiyamət günü) **Allah-Təala insanların hamısına yenidən həyat verib dirildər, ogünkü gündə əməllərini onlara xəbər verər. O əməlləri Allah-Təala ehtiva edib, tamamilə qeyd edibdir. Lakin onlar unudub, yaddan çıxarıblar. (وَاللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ شَهِيدٌ) Allah-Təala hər bir şeyi hazır olub görəndir. Heç bir şey onun elmindən kənarda qalmaz.**

**7) (اَلَمْ تَرَ اَنَّ اللّٰهَ يَعْلَمُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۜ)** - (Ey Məhəmməd), **bəs baxıb görmürsən və anlamırsan ki, həqiqətən, Allah-Təala göylərdə və yerdə olan hər bir şeyə agahdır. (مَا يَكُونُ مِنْ نَجْوٰى ثَلٰثَةٍ اِلَّا هُوَ رَابِعُهُمْ) - üç nəfər bir yerə yığılıb gizlincə danışarkən, onların dördüncüsü Allah-Təala olub, onların gizli danışıqlarına agah olar. (وَلَا خَمْسَةٍ اِلَّا هُوَ سَادِسُهُمْ) - Və beş nəfər gizli danışarkən, onların altıncısı Allah-Təala olar.**

**(وَلَٓا اَدْنٰى مِنْ ذٰلِكَ وَلَا اَكْثَرَ اِلَّا هُوَ مَعَهُمْ اَيْنَ مَا كَانُواۚ) - Bundan az və ya çox olub, harda bir yerə yığılıb, gizlin danışsalar, Allah-Təala onlarla birlikdədir və hər bir əməllərinə agahdır. (ثُمَّ يُنَبِّئُهُمْ بِمَا عَمِلُوا يَوْمَ الْقِيٰمَةِۜ) - Ondan sonra qiyamət günündə hər bir əməllərini onlara xəbər verəcəkdir. (اِنَّ اللّٰهَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ) Həqiqətən, Allah-Təala hər bir şeyə agahdır.** (Yəhudilər və münafiqlər bir-birləri ilə gizlincə danışıb, möminləri hirsləndirirdilər. Allahın Rəsulu onlara bunu qadağan etdi. İtaət etməyib, yenidən əvvəlki hallarına döndülər. O barədə növbəti ayə nazil oldu).

**8) (اَلَمْ تَرَ اِلَى الَّذٖينَ نُهُوا عَنِ النَّجْوٰى ثُمَّ يَعُودُونَ لِمَا نُهُوا عَنْهُ)** - (Ey Məhəmməd), **bəs** (yəhudi və münafiqlərə) **baxmırsan ki, gizlin danışmaq qadağan olunandan sonra yenə də qadağan olunan gizlin danışığa dönüb, danışırlar.**

وَيَتَنَاجَوْنَ بِالْاِثْمِ وَالْعُدْوَانِ وَمَعْصِيَتِ الرَّسُولِۘ وَاِذَا جَٓاؤُ۫كَ حَيَّوْكَ بِمَا لَمْ يُحَيِّكَ بِهِ اللّٰهُۙ وَيَقُولُونَ
فٖٓي اَنْفُسِهِمْ لَوْلَا يُعَذِّبُنَا اللّٰهُ بِمَا نَقُولُۜ حَسْبُهُمْ جَهَنَّمُۚ يَصْلَوْنَهَاۚ فَبِئْسَ الْمَصٖيرُ ﴿٨﴾ يَٓا اَيُّهَا الَّذٖينَ
اٰمَنُٓوا اِذَا تَنَاجَيْتُمْ فَلَا تَتَنَاجَوْا بِالْاِثْمِ وَالْعُدْوَانِ وَمَعْصِيَتِ الرَّسُولِ وَتَنَاجَوْا بِالْبِرِّ وَالتَّقْوٰىۜ وَاتَّقُوا اللّٰهَ
الَّذٖٓي اِلَيْهِ تُحْشَرُونَ ﴿٩﴾ اِنَّمَا النَّجْوٰى مِنَ الشَّيْطَانِ لِيَحْزُنَ الَّذٖينَ اٰمَنُوا وَلَيْسَ بِضَٓارِّهِمْ شَيْـًٔا اِلَّا
بِاِذْنِ اللّٰهِۜ وَعَلَى اللّٰهِ فَلْيَتَوَكَّلِ الْمُؤْمِنُونَ﴿١٠﴾

---

(وَيَتَنَاجَوْنَ بِالْاِثْمِ وَالْعُدْوَانِ وَمَعْصِيَتِ الرَّسُولِۘ) - **Möminlərə düşmənçilik və peyğəmbərə** (Məhəmmədə) **asi olmaq və günahkarlıq haqqında gizlin danışırlar.** (وَاِذَا جَٓاؤُ۫كَ حَيَّوْكَ بِمَا لَمْ يُحَيِّكَ بِهِ اللّٰهُ) - (Ey Məhəmməd), **o zaman ki, yəhudilər və münafiqlər sənin hüzuruna gəldilər, o salamı sənə verərlər ki, Allah-Təala o salamı sənə verməyibdir.** (Yəhudilər peyğəmbərin hüzuruna gələndə "əs-səlamu aleykə" əvəzinə "əs-samu aleykə" deyirdilər. "Sam" ölüm mənasınadır. Onların belə salam verməsinə heç kim diqqət etməyib, Allah-Təala öz peyğəmbərinə xəbər verir). (وَيَقُولُونَ فٖٓي اَنْفُسِهِمْ لَوْلَا يُعَذِّبُنَا اللّٰهُ بِمَا نَقُولُ) - (Ey Məhəmməd), **yəhudilər və münafiqlər, öz-özlərinə deyirlər: "Əgər bu** (Məhəmməd) **peyğəmbərdirsə, nədən ötrü Allah-Təala bizim dediyimizə** (salam əvəzinə "sam" - ölüm deməyə) **görə bizə əzab etmir?** (Allah-Təala onların cavabında növbəti ayəni buyurur:) (حَسْبُهُمْ جَهَنَّمُۚ يَصْلَوْنَهَاۚ فَبِئْسَ الْمَصٖيرُ) - (Ey Məhəmməd), **onlara əzab etməkdən ötrü cəhənnəm kifayət edər. Cəhənnəmə daxil olacaqlar. Nə pis qayıdılacaq yerdir cəhənnəm. Bundan sonrakı bir neçə ayədə Allah-Təala bizə gözəl əxlaqı əmr edir.**

**10)** (يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُٓوا اِذَا تَنَاجَيْتُمْ فَلَا تَتَنَاجَوْا بِالْاِثْمِ وَالْعُدْوَانِ وَمَعْصِيَتِ الرَّسُولِ) **Ey iman edənlər, o zaman ki, pıçıldaşıb gizli danışdınız, özünüzü yəhudilərə və münafiqlərə oxşatmayıb, onlar kimi günah və düşmənçilik və peyğəmbərə asi olmaq barəsində məxfi danışmayın.**

(وَتَنَاجَوْا بِالْبِرِّ وَالتَّقْوٰىۜ وَاتَّقُوا اللّٰهَ الَّذٖٓي اِلَيْهِ تُحْشَرُونَ) - **Əksinə fərzləri yerinə yetirib, xeyir əməl edib, təqva barəsində gizlincə danışın. O yeganə Allah-Təala ki, onun tərəfinə dirilib qayıdacaqsınız, ondan qorxub günah haqqında məxfi danışmağı tərk edin.**

**10)** (اِنَّمَا النَّجْوٰى مِنَ الشَّيْطَانِ لِيَحْزُنَ الَّذٖينَ اٰمَنُوا) **Həqiqətən, günah haqqında məxfi danışmaq şeytanın** (şəri əmr edən xəbis nəfsin) **vəsvəsəsindəndir. Onlara günah haqqında pıçıldaşmamağı əmr edir ki, digər möminlər onların pıçıldaşmasından qəmgin və məhzun olmasınlar.** (Abdullah ibn Ömər peyğəmbərdən rəvayət edib deyir: "Allahın Rəsulu buyurdu: "O zaman ki, üç nəfər bir yerə yığıldı, ikisi bir-biri ilə o bir nəfərdən gizlin danışmasınlar) *(Buxari, İstizan 47; Müslüm, Salam 37-38).*

(وَلَيْسَ بِضَٓارِّهِمْ شَيْـًٔا اِلَّا بِاِذْنِ اللّٰهِۜ وَعَلَى اللّٰهِ فَلْيَتَوَكَّلِ الْمُؤْمِنُونَ) - (Ey Məhəmməd), **Allah-**

يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوٓا اِذَا قٖيلَ لَكُمْ تَفَسَّحُوا فِي الْمَجَالِسِ فَافْسَحُوا يَفْسَحِ اللّٰهُ لَكُمْۚ وَاِذَا قٖيلَ انْشُزُوا فَانْشُزُوا يَرْفَعِ اللّٰهُ الَّذٖينَ اٰمَنُوا مِنْكُمْۙ وَالَّذٖينَ اُو۫تُوا الْعِلْمَ دَرَجَاتٍۜ وَاللّٰهُ بِمَا تَعْمَلُونَ خَبٖيرٌ﴿١١﴾

---

**Təalanın izni olmasa, gizlin danışmaq möminlərə heç bir zərər yetirməz. Lakin pıçıldaşmaq xəbis bir iş olduğundan Allah-Təala onu qadağan edir, yoxsa onların məxfi danışmasından möminlərə bir zərər gəlməz. Gərək möminlər hər bir işlərində Allah-Təalaya təvəkkül edib, pıçıldaşanların zərərindən qorxmasınlar.**

**11) (يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوٓا اِذَا قٖيلَ لَكُمْ تَفَسَّحُوا فِي الْمَجَالِسِ فَافْسَحُوا يَفْسَحِ اللّٰهُ لَكُمْ) Ey iman edənlər, o zaman ki, bir məclisdə oldunuz, məclis dar olub, başqa bir şəxs məclisə varid olarkən, sizə deyilsə ki, gələn şəxsə məclisdə yer verin, siz də qəbul edib yer verin. Allah-Təala da sizin hər bir işinizə genişlik verər. (وَاِذَا قٖيلَ انْشُزُوا فَانْشُزُوا) - O zaman ki, sizə deyildi: "Durub məclisdən ayrılın, siz də durub qalxın. (يَرْفَعِ اللّٰهُ الَّذٖينَ اٰمَنُوا مِنْكُمْۙ وَالَّذٖينَ اُو۫تُوا الْعِلْمَ دَرَجَاتٍۜ) - Məclislərdə yer verməksəbəbinə sizlərdən iman edənlərə* və xüsusi olaraq elm sahiblərinə Allah-Təala uca və ali dərəcələr verər.**

(***Qeyd:** *"Abdullah ibn Məsud bu ayəni hər dəfə oxuyanda deyərdi: "Ey insanlar, bu ayənin məzmununu dürüst anlayın, sizi elm öyrənməyə həvəsləndirən bir ayədir. Allahın Rəsulu (ə.s) buyurdu: "Alimlə abid (çox ibadət edən) arasında yüz dərəcə fərq var. Hər iki dərəcənin arası təlim verilən atın qaçması ilə yetmiş illik yoldur. Bax, gör ki, uca peyğəmbərimiz alimin fəzilətini necə sadə bir misalla bizə öyrədir. Hikmət sahibləri də belə deyiblər: "Kaş mən biləydim ki, elmsiz bir şəxs nəyi anlayıbdır və elmli şəxs nəyi itiribdir? Məşhur ərəb filosofu Əsnaf ibn Qeys belə deyir: "Alimlər millətin tərbiyəçisidirlər. O izzət ki, elm səbəbinə əldə edilməyib, zillətə düçar olacaqdır. Həqiqətən, böyük şəxslərin kəlamı da böyükdür. Elmin fəziləti haqqında nə gözəl kəlamdır. Heyf ki, islam ümməti belə ayələri, peyğəmbərin möcüzəli hədislərini və müdriklərin uca kəlamlarını birdəfəlik tərk edib, elmsiz qalıb, cəhalət və zəlalətə qərq olublar və bu səbəbdən zillət və həqarətə düçar olub, əksəriyyəti vəhşi heyvanlar kimi bir-birinə zərər verməkdən başqa bir şey bilmirlər. Bu zamanda alimlərin vəzifəsi Qurani-Şərifin uca ayələrinin məzmununu avam xalqa başa salmaq olmalıdır. Xalq Quranın hikmət və nəsihətlərinə agah olmasa, çətin ki, cəhalətdən xilas ola bilsin, bu səbəbdən ciddi çalışmaq lazımdır).*

**(وَاللّٰهُ بِمَا تَعْمَلُونَ خَبٖيرٌ) Allah-Təala hər bir əməllərinizdən agah və xəbərdardır. İnsanların əksəriyyəti peyğəmbərlə işləri olanda gedib onunla gizlin danışırdılar, o cənab da bundan bezib kədərlənirdi, bu barədə növbəti ayə nazil olub sədəqəyə əmr olundular. Yəni kim ki, istəyir peyğəmbərlə gizli danışsın, əvvəlcə sədəqə verməlidir. Elə ki sədəqə**

يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا اِذَا نَاجَيْتُمُ الرَّسُولَ فَقَدِّمُوا بَيْنَ يَدَيْ نَجْوٰيكُمْ صَدَقَةًۜ ذٰلِكَ خَيْرٌ لَكُمْ وَاَطْهَرُۜ فَاِنْ لَمْ تَجِدُوا فَاِنَّ اللّٰهَ غَفُورٌ رَحِيمٌ ﴿١٢﴾

---

**vermək məsələsi ortaya çıxdı, varlılar xəsislikdən, kasıblar yoxsulluqdan pıçıldaşmağı tərk etdilər.**

**12) (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا اِذَا نَاجَيْتُمُ الرَّسُولَ فَقَدِّمُوا بَيْنَ يَدَيْ نَجْوٰيكُمْ صَدَقَةً ) Ey* iman edənlər, o zaman ki, peyğəmbər** (Məhəmməd) **ilə gizli danışmaq istədiniz, əvvəlcə sədəqə verin, ondan sonra pıçıldaşın. (ذٰلِكَ خَيْرٌ لَكُمْ وَاَطْهَرُ) Pıçıldaşmadan əvvəl sədəqə vermək sizdən ötrü yaxşı və pakizə bir əmrdir.**

**(فَاِنْ لَمْ تَجِدُوا فَاِنَّ اللّٰهَ غَفُورٌ رَحِيمٌ) - Əgər kasıb olduğunuzdan sədəqə verməyə bir şey tapmasanız, həqiqətən, Allah-Təala tapmayanlara rəhm edib bağışlayandır.**

**(*Qeyd:** *"Əli (ə.s) deyir: "Elə ki, bu ayə nazil oldu, peyğəmbər məndən soruşdu: "Bu sədəqədə bir dinara nə deyirsən? Mən dedim: çoxdur, gücləri çatmaz. Buyurdu: "Bəs nə qədər olsun?" Dedim: "Bir dənə buğda, ya da arpa ağırlığında qızıl vermək kifayət edər". Buyurdu: "Sənin malın azdır, öz malına görə təqdir etdin". Yenə Əli (ə.s) deyir: "Qurani-Şərifdə bu ayəyə nə məndən əvvəl, nə də məndən sonra əməl edən olmadı. Bir dinar varım idi. Onu on dirhəm edib, on dəfə verib, on dəfə peyğəmbər ilə məxfi danışdım". Abdullah ibn Ömər deyir: "Əlinin üç fəziləti var idi. Əgər məndə o fəzilətlərin biri olsaydı, mənim üçün qırmızı tüklü dəvələrdən daha sevimli olardı. 1) Fatimeyi-Zəhra ilə evlənməsi, 2) Xeybər savaşında peyğəmbərin cihad bayrağını ona verməsi, 3) "Nəcva" ("pıçıldaşmaq") ayəsinə əməl etməsi. Xazin öz təfsirində Əlinin bu ayəyə əməl etməsini nəql edəndən sonra sual-cavab şəklində deyir: "Əgər desən ki, bu ayədə Əlidən ötrü böyük mənfəət vardır, çünki ondan başqa səhabədən bu ayəyə əməl eyləyən olmayıbdır, cavabında belə deyərəm: "Necə ki, deyirsən, etdir, Əlidən ötrü böyük mənfəət vardır, lakin digər səhabələrə də tənə edilməz, çünki o qədər vaxtları olmadı ki, bu ayəyə əməl etsinlər. Əgər vaxtları olsaydı, ayəyə əməl etməkdən üz döndərməzdilər. Zənn edək ki, vaxtları var idi, lakin zəngin səhabələr kasıbları düşünüb, ona görə sədəqə vermədilər ki, onlar kasıblıqlarına görə məhzun olmasınlar. Bir digər cavab da budur ki, o sədəqə nə vacib, nə də savab növündən deyildi. Bu sədəqəyə məxfi söhbəti tərk etməkdən ötrü əmr edildilər. Çünki məxfi söhbətin tərk olunması əsas idi. Bununla belə digər səhabələr ayəyə əməl etmədikləri üçün qınanmamalıdır. Xazinin sözü burada bitdi. Müəllif deyir: "Bu şəxsin bu kəlamı qeyd etməsi son dərəcə təəccüblüdür. Ayəyə Əli əməl etdi, ya başqası, bundan kimə nə tənə varid olacaq? Çünki ayəyə əməl etmək onların öz işidir. Bir fəzilət Əliyə aid olub, başqasına aid olmayanda, bundan ötrü nə sual-cavab lazımdır? Belə fəzilətli şəxslərin belə sözlər deməsi islam ümmətinin təfriqəsinə və bir-birlərini təkfir etməsinə bais olubdur. Dürüst diqqət edilsin, bu kimi fəzilətli şəxslərin sözünün altında başqa mənalar olub, məqsədi başqa şey-*

**ءَاَشْفَقْتُمْ اَنْ تُقَدِّمُوا بَيْنَ يَدَيْ نَجْوٰيكُمْ صَدَقَاتٍۜ فَاِذْ لَمْ تَفْعَلُوا وَتَابَ اللّٰهُ عَلَيْكُمْ فَاَقِيمُوا الصَّلٰوةَ وَاٰتُوا الزَّكٰوةَ وَاَطِيعُوا اللّٰهَ وَرَسُولَهُۜ وَاللّٰهُ خَبِيرٌ بِمَا تَعْمَلُونَ۟ ﴿١٣﴾ اَلَمْ تَرَ اِلَى الَّذِينَ تَوَلَّوْا قَوْمًا غَضِبَ اللّٰهُ عَلَيْهِمْۜ مَا هُمْ مِنْكُمْ وَلَا مِنْهُمْۙ**

---

*dir. Sözünün əvvəlində bu işdə Əlinin fəzilətini təsdiq edir. Axırda isə sədəqəni vaciblikdən, savablıqdan çıxarıb, boş bir şey hesab edir, halbuki ayədə sədəqənin vacib olması əmr olunubdur. Əgər sədəqə vacib olmasaydı, məxfi danışıq necə tərk olunardı? Əgər vacib də olmasa, hər halda gərək savab sayılsın. Necə ki, ayədə buyurdu: "Bu sədəqə vermək sizdən ötrü xeyir bir əməl və pakizə bir iş-dir". Xeyir bir əməl necə savab sayılmaz? Sözünün ortasında isə Əlini müqəssir və tənə edilməyə layiq, digər səhabələri isə eyib və nöqsandan pak göstərir. Bir sözündə deyir ki, digər səhabələr kasıbları düşünüb, ona görə sədəqə vermədilər ki, onlar kasıblıqlarına görə məhzun olmasınlar. Belə məlum olur ki, Əli kasıbla-rın məhzun olmasına bais olubdur. Belə olanda Əli müqəssir sayılır. İmam Əlini müqəssir göstərməkdə qayə nədir? Belə kəlamlar islam ümmətini fəlakətə düçar edib. Ayədə məxfi söhbətdən əvvəl sədəqə əmr olunubdur. Əli cənabları sədəqə verib, peyğəmbərlə məxfi söhbət edibdir. Ondan başqası etməyibdir. Bundan əlbəttə Əlinin fəziləti məlum olur, lakin Əlidən başqasına da tənə varid olur, ya olmur? Belə sözlər islamı bərbad etdi. Ümidvarıq ki, bundan sonra islam alimləri belə kəlamları və mübahisələri tərk edib, keçmiş hadisələri doğru anlayaraq, müsəlmanlar arasında yaxınlaşmaya səbəb olacaqlar. Allah insanların xeyirli işlərində yardımçılarıdır).*

**13) (ءَاَشْفَقْتُمْ اَنْ تُقَدِّمُوا بَيْنَ يَدَيْ نَجْوٰيكُمْ صَدَقَاتٍۜ) - Bəs peyğəmbər ilə gizli da-nışmaqdan əvvəl sədəqə verməkdən qorxdunuz ki, birdən kasıblaşarsız?**

**(فَاِذْ لَمْ تَفْعَلُوا وَتَابَ اللّٰهُ عَلَيْكُمْ فَاَقِيمُوا الصَّلٰوةَ وَاٰتُوا الزَّكٰوةَ وَاَطِيعُوا اللّٰهَ وَرَسُولَهُ) - İndi ki, məxfi danışıqdan əvvəl sədəqə vermək sizə çətindir, Allah-Təala si-zin üzrxahlığınızı qəbul edib, sizi sədəqəni tərk etməkdə azad edib, sədəqənin vacibliyini sizdən qaldırdı. Lakin hər bir işdə Allah-Təalaya və peyğəmbərinə itaət edib, namaz qılıb, zəkat verin.** (Bu ayə ilə "Xa-zin təfsiri" sahibinin sədəqəni vaciblikdən çıxarması çox təəccüblüdür). **(وَاللّٰهُ خَبِيرٌ بِمَا تَعْمَلُونَ۟) Hər bir əməllərinizə Allah-Təala agah və xəbərdardır.** (Münafiqlər Mədinədə yəhudilərlə dostluq edib, müsəlmanların gizli işlərini onlara bildirirdilər. Bu barədə növbəti ayə nazil oldu).

**14) (اَلَمْ تَرَ اِلَى الَّذِينَ تَوَلَّوْا قَوْمًا غَضِبَ اللّٰهُ عَلَيْهِمْۜ مَا هُمْ مِنْكُمْ وَلَا مِنْهُمْ)** - (Ey Məhəmməd), **bəs baxmırsan, o münafiqlərə ki, zahirdə özlərinə müsəlman deyib, amma batində Allah-Təalanın qəzəbləndiyi bir camaatla** (yəhudilərlə) **dostluq edib, möminlərin sirlərini onlara nəql edirlər? O münafiqlər nə sizdən, nə də yəhudilərdən deyildir. Əksinə, avara adamlardır.**

وَيَحْلِفُونَ عَلَى الْكَذِبِ وَهُمْ يَعْلَمُونَ ﴿١٤﴾ اَعَدَّ اللّٰهُ لَهُمْ عَذَابًا شَدِيدًاؕ اِنَّهُمْ سَٓاءَ مَا كَانُوا يَعْمَلُونَ
﴿١٥﴾ اِتَّخَذُوٓا اَيْمَانَهُمْ جُنَّةً فَصَدُّوا عَنْ سَبِيلِ اللّٰهِ فَلَهُمْ عَذَابٌ مُهِينٌ ﴿١٦﴾ لَنْ تُغْنِيَ عَنْهُمْ
اَمْوَالُهُمْ وَلَا اَوْلَادُهُمْ مِنَ اللّٰهِ شَيْـًٔاؕ اُو۬لٰٓئِكَ اَصْحَابُ النَّارِۚ هُمْ فِيهَا خَالِدُونَ ﴿١٧﴾ يَوْمَ يَبْعَثُهُمُ اللّٰهُ
جَمِيعًا فَيَحْلِفُونَ لَهُ كَمَا يَحْلِفُونَ لَكُمْ وَيَحْسَبُونَ اَنَّهُمْ عَلٰى شَيْءٍؕ اَلَٓا اِنَّهُمْ هُمُ الْكَاذِبُونَ ﴿١٨﴾
اِسْتَحْوَذَ عَلَيْهِمُ الشَّيْطَانُ فَاَنْسٰيهُمْ ذِكْرَ اللّٰهِؕ اُو۬لٰٓئِكَ حِزْبُ الشَّيْطَانِؕ اَلَٓا اِنَّ حِزْبَ الشَّيْطَانِ هُمُ
الْخَاسِرُونَ ﴿١٩﴾

---

(وَيَحْلِفُونَ عَلَى الْكَذِبِ وَهُمْ يَعْلَمُونَ) **Yalan yerə** (müsəlmanlıq iddiası etməyə) **and içib deyirlər: "Biz müsəlmanıq və halbuki özləri də bilirlər ki, yalandan and içirlər, müsəlman deyildirlər.**

**15)** (اَعَدَّ اللّٰهُ لَهُمْ عَذَابًا شَدِيدًاؕ) **Allah-Təala münafiqlərdən ötrü axirətdə şiddətli əzab hazırlayıbdır.** (اِنَّهُمْ سَٓاءَ مَا كَانُوا يَعْمَلُونَ) **Həqiqətən, münafiqlərin əməlləri həmişə pis əməllər olub və o əməllərdə israr ediblər.**

**16)** (اِتَّخَذُوٓا اَيْمَانَهُمْ جُنَّةً فَصَدُّوا عَنْ سَبِيلِ اللّٰهِ فَلَهُمْ عَذَابٌ مُهِينٌ) **- Münafiqlər yalandan and içmələrini (hansı ki, and içib deyirdilər: "Biz müsəlmanıq" özlərinə pərdə edib, o and səbəbinə nifaqlarını gizlədib, batində insanları Allah-Təalanın dininə daxil olmaqdan saxlayıb, mane olurlar və bu səbəbdən onlardan ötrü zəlil edən əzab vardır.**

**17)** (لَنْ تُغْنِيَ عَنْهُمْ اَمْوَالُهُمْ وَلَا اَوْلَادُهُمْ مِنَ اللّٰهِ شَيْـًٔاؕ اُو۬لٰٓئِكَ اَصْحَابُ النَّارِۚ هُمْ فِيهَا خَالِدُونَ) **- Münafiqlərin mal və övladları onları Allah-Təaladan ehtiyacsız etməz. Bu münafiqlər cəhənnəm əhli olub və cəhənnəmdə həmişəlik qalacaqlar.**

**18)** (يَوْمَ يَبْعَثُهُمُ اللّٰهُ جَمِيعًا فَيَحْلِفُونَ لَهُ كَمَا يَحْلِفُونَ لَكُمْ) **- O gün ki,** (qiyamət günü) **Allah-Təala münafiqlərin hamısını dirildəcək, o gün də Allah-Təalaya** (yalandan) **and içərlər ki, biz dünyada müsəlman idik, necə ki, sizə and içirlər. Sizə and içmələri təəccüblü deyil. Qeybləri bilən Allah-Təalaya and içmələri təəccüblüdür.** (وَيَحْسَبُونَ اَنَّهُمْ عَلٰى شَيْءٍؕ) **Zənn edirlər ki, axirətdə yalandan and içməklə bir fayda qazanırlar, necə ki, dünyada fayda qazanıb, canları və malları mühafizə olunur.** (اَلَٓا اِنَّهُمْ هُمُ الْكَاذِبُونَ) - (Ey Məhəmməd), **xəbərdar ol ki, münafiqlər dünya və axirətin hər ikisində də yalançıdırlar.**

**19)** (اِسْتَحْوَذَ عَلَيْهِمُ الشَّيْطَانُ فَاَنْسٰيهُمْ ذِكْرَ اللّٰهِ) - (Ey Məhəmməd), **şeytan münafiqlərə qalib olub, Allah-Təalanı zikr etməyi onlara unutdurdu. Nə qəlb, nə də dilləri ilə Allah-Təalanı zikr etmirlər.**

(اُو۬لٰٓئِكَ حِزْبُ الشَّيْطَانِؕ اَلَٓا اِنَّ حِزْبَ الشَّيْطَانِ هُمُ الْخَاسِرُونَ) - (Ey Məhəmməd), **bu münafiqlər şeytanın qoşunlarıdırlar, xəbərdar ol ki, həqiqətən, dünya və axirətdə özlərinə qarşı ziyankar olanlar şeytanın qoşunu olan münafiqlərdir.**

اِنَّ الَّذِينَ يُحَآدُّونَ اللّٰهَ وَرَسُولَهُ اُولٰٓئِكَ فِي الْاَذَلّٖينَ ﴿٢٠﴾ كَتَبَ اللّٰهُ لَاَغْلِبَنَّ اَنَا۬ وَرُسُلٖيۜ اِنَّ اللّٰهَ قَوِيٌّ
عَزٖيزٌ ﴿٢١﴾ لَا تَجِدُ قَوْمًا يُؤْمِنُونَ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ يُوَآدُّونَ مَنْ حَآدَّ اللّٰهَ وَرَسُولَهُ وَلَوْ كَانُوٓا اٰبَٓاءَهُمْ
اَوْ اَبْنَٓاءَهُمْ اَوْ اِخْوَانَهُمْ اَوْ عَشٖيرَتَهُمْۜ اُولٰٓئِكَ كَتَبَ فٖي قُلُوبِهِمُ الْاٖيمَانَ وَاَيَّدَهُمْ بِرُوحٍ مِنْهُۜ وَيُدْخِلُهُمْ
جَنَّاتٍ تَجْرٖي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدٖينَ فٖيهَاۜ رَضِيَ اللّٰهُ عَنْهُمْ وَرَضُوا عَنْهُۜ اُولٰٓئِكَ حِزْبُ اللّٰهِۜ اَلَٓا
اِنَّ حِزْبَ اللّٰهِ هُمُ الْمُفْلِحُونَ ﴿٢٢﴾

---

**20-21)** (اِنَّ الَّذِينَ يُحَآدُّونَ اللّٰهَ وَرَسُولَهُ اُولٰٓئِكَ فِي الْاَذَلّٖينَ) - (Ey Məhəmməd), **həqiqətən, o şəxslər ki, Allah-Təalaya və onun peyğəmbərinə** (Məhəmmədə) **düşmən olub, onların əmrlərinə müxalif olsa, belə şəxslər məxluqatın ən zəlili sayılar.** (كَتَبَ اللّٰهُ لَاَغْلِبَنَّ اَنَا۬ وَرُسُلٖيۜ) **Allah-Təala qəti hökm veribdir ki, əlbəttə, mən özüm və peyğəmbərlərim düşmənlərimizə qalib olacağıq.** (اِنَّ اللّٰهَ قَوِيٌّ عَزٖيزٌ) **Həqiqətən, Allah-Təala qüvvətlidir və məxluqatına qalibdir. Belə olan halda Allah-Təalaya və peyğəmbərə düşmən olmaq münafiqlərə bir fayda verməz.**

**22)** (لَا تَجِدُ قَوْمًا يُؤْمِنُونَ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ يُوَآدُّونَ مَنْ حَآدَّ اللّٰهَ وَرَسُولَهُ وَلَوْ كَانُوٓا اٰبَٓاءَهُمْ اَوْ اَبْنَٓاءَهُمْ اَوْ اِخْوَانَهُمْ اَوْ عَشٖيرَتَهُمْ)

(Ey Məhəmməd), **bir qövm və bir camaat ki, Allah-Təalaya və axirət gününə iman edir, belə camaatı Allah-Təalaya və onun peyğəmbərinə düşmən olanlarla dostluq edən görməzsən. Möminlərdən belə iş meydana gəlməz. Hərçənd möminlərin ataları, oğlanları, qardaşları, ya da ki, qohumları Allahın və peyğəmbərin düşməni olsa da, mömin şəxs onlarla dostluq etməz.** (اُولٰٓئِكَ كَتَبَ فٖي قُلُوبِهِمُ الْاٖيمَانَ وَاَيَّدَهُمْ بِرُوحٍ مِنْهُ) **Allah-Təala belə möminlərin qəlblərindəki imanı möhkəm edib, öz tərəfindən ruhani bir qüvvə ilə onları qüvvətləndirib, kömək etmişdir və bu səbəbdən dünyada həmişə düşmənlərinə qalib olurlar. (İslamın ilk dövründə yaşayan möminlərin halı belə idi).**

(وَيُدْخِلُهُمْ جَنَّاتٍ تَجْرٖي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدٖينَ فٖيهَاۜ) **Axirətdə də Allah-Təala onları qəsrlərinin və ağaclarının altından çaylar axan cənnətlərə daxil edər və o cənnətlərdə həmişəlik qalıb, oradan çıxmazlar.** (رَضِيَ اللّٰهُ عَنْهُمْ وَرَضُوا عَنْهُ) **Allah-Təala onlardan razıdır, onlar da Allah-Təaladan böyük əcr və savablara nail olub, razı olarlar.**

(اُولٰٓئِكَ حِزْبُ اللّٰهِۜ اَلَٓا اِنَّ حِزْبَ اللّٰهِ هُمُ الْمُفْلِحُونَ) **Allah-Təalanın qoşunu ancaq bu möminlərdir.** (Ey Məhəmməd), **xəbərdar ol ki, həqiqətən, Allah-Təalanın qoşunu düşmənlərinə qalib olar, onlar nicat tapanlardır.**

Allaha həmd olsun, əl-Mücadələ surəsinin təfsiri tamamlandı. Axırıncı ayənin mənası bir zəruri hökmü ehtiva edir. Diqqət etmək lazımdır. Gərək

islam ümməti bu hökmə möhkəm yapışıb tərk etməsinlər. Allahın Rəsulu buyurdu: *“Kim əl-Mücadələ surəsini oxusa, qiyamət günündə Allah-Təalanın ordusundan sayılar”*.

## əl-HƏŞR SURƏSİ

59-cu surədir. Mədinədə nazil olub, 24 ayə, 445 kəlmə və 1913 hərfdir.

سَبَّحَ لِلَّهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْأَرْضِ ۖ وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ ﴿١﴾

**Bismillahir-Rəhmanir-Rəhim**

Allahın Rəsulu (ə.s) Məkkədən hicrət edib Mədinəyə varid olandan sonra Mədinə ətrafında yaşayan yəhudilərdən Bəni-Nəzir camaatı peyğəmbərin hüzuruna gəlib, bir-birilərinə zərər verməyib, savaşmamaları haqqında sülh müqaviləsi bağladılar. Allahın Rəsulu onlarla bu əhdi bağlayıb, onlardan arxayın oldu. Hicrətin ikinci ilində elə ki, Məkkə əhli ilə olan Bədir savaşında peyğəmbər müşriklərə qalib gəldi, Bəni-Nəzir camaatı dedilər: “Bu, həmin peyğəmbərdir ki, Allah-Təala onun vəsfini Tövratda bəyan edibdir. Ondan sonra hicrətin üçüncü ilində Uhud savaşı olanda elə ki, peyğəmbərin qoşunu məğlub oldu, Bəni-Nəzir camaatı şəkkə düşüb onunla bağladıqları müqaviləni pozdular. Onların rəisləri Kə`b Əşrəf oğlu 40 nəfərlə Məkkəyə gedib, peyğəmbərin əleyhinə savaşmaq üçün Qüreyş camaatı ilə əhd bağlayıb, and içdilər. Əbu Süfyan 40 nəfərlə, Kə`b də 40 nəfərlə Məscidül-harama daxil olub, bir-birilərinə söz verib, əhd bağladılar. Kə`b oradan qayıdıb Mədinəyə getdi. Peyğəmbər Bəni-Nəzir camaatının bu əməlindən xəbərdar oldu. Əhdi pozduqlarına görə Mədinə əhlini yığıb, onlara hücum etməyi əmr etdi. O cənab özü xurma lifindən cilovu olan bir uzunqulağa minmişdi. Ənsardan Məhəmməd ibn Məsləmə yəhudilərin rəisi Kə`b ibn Əşrəf ilə süd qardaşı idi. Gecə vaxtı onun yanına gedib, onu evindən hiylə ilə çıxarıb, qətl etdi. Peyğəmbər onlara xəbər göndərdi ki, əhdi pozduğunuza görə Mədinədən çıxın. Cavab verib dedilər: “Bizim burdan getməmizdənsə, ölməmiz daha yaxşıdır. Mədinədə olan münafiqlər onlara xəbər göndərdi ki, yurdlarınızdan çıxmayıb, savaşa hazırlaşın, biz də sizə kömək edərik. Onlar da savaşa hazırlaşdılar. Peyğəmbərin qoşunu iyirmi bir gecə onları mühasirədə saxladı. Allah-Təala onların qəlblərinə qorxu salıb, münafiqlərin onlara kömək edəcəklərindən ümidlərini kəsib, peyğəmbərdən sülh xahiş etdilər. Peyğəmbər də onlara bir şərtlə aman verdi ki, hər üç ev öz mallarından bir dəvə yükü götürüb, hara getmək istəyirlərsə, getsinlər. Onlar da qəbul edib, hamısı köçüb, Şam tərəfinə getdilər. Necə ki, bundan sonrakı ayələrdə xəbər verir).

**1) (سَبَّحَ لِلَّهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْأَرْضِ ۖ وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ) Göylərdə və yerdə olan hər bir məxluq** (vücudən və zatən) **Allah-Təalanı zikr edib, hər bir**

هُوَ الَّذِيٓ اَخْرَجَ الَّذِينَ كَفَرُوا مِنْ اَهْلِ الْكِتَابِ مِنْ دِيَارِهِمْ لِاَوَّلِ الْحَشْرِۜ مَا ظَنَنْتُمْ اَنْ يَخْرُجُوا
وَظَنُّوٓا اَنَّهُمْ مَانِعَتُهُمْ حُصُونُهُمْ مِنَ اللّٰهِ فَاَتٰيهُمُ اللّٰهُ مِنْ حَيْثُ لَمْ يَحْتَسِبُوا وَقَذَفَ فٖي قُلُوبِهِمُ الرُّعْبَ
يُخْرِبُونَ بُيُوتَهُمْ بِاَيْدٖيهِمْ وَاَيْدِي الْمُؤْمِنٖينَ فَاعْتَبِرُوا يَٓا اُو۬لِي الْاَبْصَارِ ﴿٢﴾ وَلَوْلَٓا اَنْ كَتَبَ اللّٰهُ
عَلَيْهِمُ الْجَلَٓاءَ لَعَذَّبَهُمْ فِي الدُّنْيَاۜ وَلَهُمْ فِي الْاٰخِرَةِ عَذَابُ النَّارِ ﴿٣﴾ ذٰلِكَ بِاَنَّهُمْ شَٓاقُّوا اللّٰهَ وَرَسُولَهُۚ
وَمَنْ يُشَٓاقِّ اللّٰهَ فَاِنَّ اللّٰهَ شَدٖيدُ الْعِقَابِ ﴿٤﴾

---

**eyib və nöqsandan pak və müqəddəs sayırlar. Məxluqata qalib və onların işlərini hikmət üzrə təqdir edən Allah-Təaladır.**

**2) (هُوَ الَّذِيٓ اَخْرَجَ الَّذِينَ كَفَرُوا مِنْ اَهْلِ الْكِتَابِ مِنْ دِيَارِهِمْ لِاَوَّلِ الْحَشْرِۜ) Allah-Təala öz kamil qüdrəti ilə ilk dəfə kitab əhlindən kafir olan Bəni-Nəzir yəhudilərini sürgün edib, yurdlarından çıxartdı.** (Ərəbistan yarımadasından ilk qovulan yəhudi camaatı Bəni-Nəzir olduğuna görə ayədə ilk dəfə ifadəsi işlədilir). **(مَا ظَنَنْتُمْ اَنْ يَخْرُجُوا) Halbuki siz möminlər onların** (möhkəm qalalarına və özlərinin izzət və qüdrətlərinə görə) **öz yurdlarından çıxacaqlarını zənn etmirdiniz. (وَظَنُّوٓا اَنَّهُمْ مَانِعَتُهُمْ حُصُونُهُمْ مِنَ اللّٰهِ)** (Bəni-Nəzir yəhudiləri) **özləri də zənn etdilər ki, onların möhkəm qalaları onları Allah-Təalanın əzabından mühafizə edər. (فَاَتٰيهُمُ اللّٰهُ مِنْ حَيْثُ لَمْ يَحْتَسِبُوا) Amma onların zənn etmədiyi tərəfdən Allah-Təalanın əmri gəlib, onları yaxaladı.** (Rəisləri Kə`b ibn əl-Əşrəf öldürülüb, özləri də zəiflədilər). **(وَقَذَفَ فٖي قُلُوبِهِمُ الرُّعْبَ) Allah-Təala** (Bəni-Nəzir) **camaatının qəlbinə şiddətli qorxu saldı. (يُخْرِبُونَ بُيُوتَهُمْ بِاَيْدٖيهِمْ وَاَيْدِي الْمُؤْمِنٖينَ) - Onlar evlərinin içini öz əlləri ilə, çölünü də müsəlmanların əli ilə xarab etdilər.** (Elə ki, Bəni-Nəzir camaatı evlərindən çıxmağa başladı, evlərinin içində olan zinət əşyalarını xarab edib, ondan sonra çıxdılar). **(فَاعْتَبِرُوا يَٓا اُو۬لِي الْاَبْصَارِ) Ey bəsirət sahibləri, Allah-Təalanın müsəlmanları necə onlara hakim edib, asan yolla onları yurdlarından çıxartmasından ibrət alıb, Allah-Təalanın qüdrətinə agah olun.**

**3) (وَلَوْلَٓا اَنْ كَتَبَ اللّٰهُ عَلَيْهِمُ الْجَلَٓاءَ لَعَذَّبَهُمْ فِي الدُّنْيَاۜ وَلَهُمْ فِي الْاٰخِرَةِ عَذَابُ النَّارِ) - Əgər Allah-Təala onlara vətənlərini tərk etməyi** (onlar üçün ölümdən betər idi) **təqdir etməsəydi, əlbəttə dünyada onları qətl edərək** (Bəni-Qüreyzə yəhudilərinə əzab edən kimi) **əzab edərdi. Vətənlərindən qovulmaqla birlikdə onlardan ötrü axirətdə od əzabı vardır.**

**4) (ذٰلِكَ بِاَنَّهُمْ شَٓاقُّوا اللّٰهَ وَرَسُولَهُ)** (Bəni-Nəzir) **yəhudilərinin bu zillətə düçar olması o səbəbədir ki, həqiqətən, onlar Allah-Təalaya və onun peyğəmbərinə** (Məhəmmədə) **müxalif olub, əhdi pozub, itaətdən çıxdılar.**

**(وَمَنْ يُشَٓاقِّ اللّٰهَ فَاِنَّ اللّٰهَ شَدٖيدُ الْعِقَابِ) - Və kim Allah-Təalaya və onun peyğəmbərinə müxalif olub, əhdi pozub, itaətdən çıxsa, həqiqətən, Allah-Təala elə şəxslərə şiddətli cəza verəndir.** (Elə ki, peyğəmbərin qoşunu Bəni-Nəzir

مَا قَطَعْتُمْ مِنْ لِينَةٍ اَوْ تَرَكْتُمُوهَا قَٓائِمَةً عَلٰٓى اُصُولِهَا فَبِاِذْنِ اللّٰهِ وَلِيُخْزِيَ الْفَاسِقِينَ ﴿٥﴾ وَمَٓا اَفَٓاءَ اللّٰهُ عَلٰى رَسُولِهِ مِنْهُمْ فَمَٓا اَوْجَفْتُمْ عَلَيْهِ مِنْ خَيْلٍ وَلَا رِكَابٍ وَلٰكِنَّ اللّٰهَ يُسَلِّطُ رُسُلَهُ عَلٰى مَنْ يَشَٓاءُ وَاللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ قَد۪يرٌ ﴿٦﴾ مَٓا اَفَٓاءَ اللّٰهُ عَلٰى رَسُولِهِ مِنْ اَهْلِ الْقُرٰى فَلِلّٰهِ وَلِلرَّسُولِ وَلِذِي الْقُرْبٰى وَالْيَتَامٰى وَالْمَسَاك۪ينِ وَابْنِ السَّب۪يلِ

---

camaatını mühasirəyə aldı, onların xurma ağaclarını bəziləri kəsdi, bəziləri isə bunu qadağan etdi. Bu barədə növbəti ayə nazil oldu).

**5-6) (**مَا قَطَعْتُمْ مِنْ لِينَةٍ اَوْ تَرَكْتُمُوهَا قَٓائِمَةً عَلٰٓى اُصُولِهَا فَبِاِذْنِ اللّٰهِ وَلِيُخْزِيَ الْفَاسِقِينَ**) Ey möminlər, hər bir xurma ağacını ki, kəsdiniz, ya da onları kökü üstündə salamat qoydunuz, bu işlərin hər ikisi Allah-Təalanın izni ilə olubdur. Sizlərdən heç birinizə qınama yoxdur və xüsusən ağacların kəsilməsinə Allah-Təala izin verir, ta ki, fasiq yəhudiləri o kəsilmək səbəbi ilə qeyzə gətirib, zəlil etsin.** (Elə ki, Bəni-Nəzir yəhudiləri yurdlarını qoyub getdilər, onların qalan mallarının və yerlərinin digər qənimətlər kimi bölüşdürülməsini müsəlman qoşunu peyğəmbərdən xahiş etdi. O vaxt da növbəti ayə nazil oldu). **(**وَمَٓا اَفَٓاءَ اللّٰهُ عَلٰى رَسُولِهِ مِنْهُمْ فَمَٓا اَوْجَفْتُمْ عَلَيْهِ مِنْ خَيْلٍ وَلَا رِكَابٍ**) Hər bir qənimət ki, Allah-Təala** (Bəni-Nəzir) **camaatından peyğəmbəri** (Məhəmmədə) **qaytardı, siz onu əldə etmək üçün nə at, nə də dəvə ilə hərəkət edib, cihad etməkdə zəhmət çəkməyibsiniz. O qənimətlər savaşsız hasil olubdur və bu səbəbdən o qənimətlər peyğəmbərə məxsusdur.** (Bəni-Nəzir camaatı Mədinədən iki mil (üç kilometrdən uzaq) məsafədə məskun idilər. Qoşun oraya piyada gedib, ancaq peyğəmbər uzunqulağa minmişdi).

**(**وَلٰكِنَّ اللّٰهَ يُسَلِّطُ رُسُلَهُ عَلٰى مَنْ يَشَٓاءُ وَاللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ قَد۪يرٌ**) Siz bu qənimətdə heç bir zəhmət çəkməyibsiniz, lakin Allah-Təala istəsə öz peyğəmbərlərini hər bir camaata istəsə savaşsız savaşsız hakim edər, o cümlədən Hz. Məhəmmədi Bəni-Nəzirə savaşsız qalib etdi, Allah-Təala hər bir şeyə qadirdir. Necə ki, sizi düşmənə savaşsız qalib etdi və bu səbəbdən Bəni-Nəzirdən hasil olan qənimət peyğəmbərə məxsusdur. Digər qənimətlər kimi paylaşılmaz. (Allah-Təala əvvəlki ayədə belə qənimətin peyğəmbərə məxsus olduğunu bəyan edib, növbəti ayədə bu qənimətin hara sərf ediləcəyini bəyan edir).**

**7) (**مَٓا اَفَٓاءَ اللّٰهُ عَلٰى رَسُولِهِ مِنْ اَهْلِ الْقُرٰى فَلِلّٰهِ وَلِلرَّسُولِ وَلِذِي الْقُرْبٰى وَالْيَتَامٰى وَالْمَسَاك۪ينِ وَابْنِ السَّب۪يلِ**)**

**(*Qeyd:** *"Müşriklərdən savaşsız alınan mallara "fey" deyilir və peyğəmbərə məxsusdur. Amma cihad edib, zorla alınan mallardan müsəlmanlara qənimət verilir).*

**Hər bir qəniməti ki, Allah-Taəala öz bölgələrində məskun olan müşriklərdən peyğəmbərinə verir, o qənimət gərək** (xüms bölünən kimi) **altı yerə bölünsün, bir hissə Allah-Təalanın, bir hissə peyğəmbərin** (Allah-

كَيْ لَا يَكُونَ دُولَةً بَيْنَ الْاَغْنِيَاءِ مِنْكُمْ ۚ وَمَآ اٰتٰيكُمُ الرَّسُولُ فَخُذُوهُ وَمَا نَهٰيكُمْ عَنْهُ فَانْتَهُواۚ وَاتَّقُوا اللّٰهَ ۗ اِنَّ اللّٰهَ شَدِيدُ الْعِقَابِۢ ﴿٧﴾

Təalanın hissəsi də peyğəmbərə çatır ki, o, rəis olduğu üçün payı bir qədər artıq olsun), **bir hissə peyğəmbərin qohumları olan Bəni-Haşimin, bir hissə yetimlərin, bir hissə pulu olmadığı üçün yolda qalan müsafirlərin.** (Peyğəmbər özünə məxsus olan qənimətdən iki hissə götürüb, dörd hissəni ayədə qeyd olunan dörd qrupa payladı). **(كَيْ لَا يَكُونَ دُولَةً بَيْنَ الْاَغْنِيَاءِ مِنْكُمْ) Allah-Təala belə qəniməti peyğəmbərə məxsus etdi ki, qənimət sizin içinizdəki zənginlər arasında dövr etməsin, ta ki, zənginlərin malı daha da çoxalıb, kasıblara çox üstün olmasınlar. Qənimət də ayədə qeyd olunan dörd qrupa bölünüb, onlar da məişətlərini təmin etsinlər. (وَمَآ اٰتٰيكُمُ الرَّسُولُ فَخُذُوهُ) Allahın Rəsulu sizə nə əmr etsə, onu qəbul edin, o cümlədən qəniməti sizin aranızda necə bölüşdürüb versə, qəbul edib, razı olun.**

**(وَمَا نَهٰيكُمْ عَنْهُ فَانْتَهُواۚ) - Və peyğəmbərin sizə qadağan etdiyi hər bir şeydən çəkinib, ona itaət edin. O cümlədən əgər qənimət almağı sizə qadağan etsə, bundan çəkinin, nəfsiniz onu arzulamasın. (وَاتَّقُوا اللّٰهَ ۗ اِنَّ اللّٰهَ شَدِيدُ الْعِقَابِۢ) Allah-Təaladan qorxub, peyğəmbərin əmr və qadağalarına müxalifət** etməyin, həqiqətən, Allah-Təala müxalifət edənlərə şiddətli əzab edəndir.**

**(**Qeyd:** *"Abdullah ibn Məsud "Allah parik taxan, saç əkdirən, bədəninə döymə edən və etdirən qadınlara lənət etmişdir" hədisini nəql etdi, hədisin mənası belədir: "Allahın Rəsulu qadınlar haqqında buyurdu: "Allah-Təala lənət etsin o qadınlara ki, digər qadınların bədənlərinə iynə ilə naxış vururlar və lənət etsin o qadınlara ki, özlərinə belə naxış vurulmasını qəbul edirlər. Bəni-Əsəd camaatından Quranı oxuya bilən Ümmü Yaqub adlı bir qadın bu hədisi eşidib, Abdullah ibn Məsudun yanına gedib dedi: "Bu nə hədisdir, eşitmişəm qadınlara lənət edirsən? Abdullah dedi: "Nədən ötrü Allah-Təalanın hökmünə tabe olmayıb, peyğəmbərin lənət etdiyinə lənət etməyim? Qadın dedi: "Mən Quranı oxumuşam, lakin bu qadınlara lənət edildiyini Qurani-Şərifdə görməmişəm. Abdullah dedi: "Əgər doğru oxusaydın, görərdin. Allah-Təala Qurani-Şərifində buyurur: "Peyğəmbər sizə nə əmr etdisə, qəbul edin və sizə nəyi qadağan etdisə, ondan çəkinin". Buna əsasən peyğəmbərin hökmü Allah-Təalanın hökmüdür. Bu hədisə diqqət etmək lazımdır. Bu hədisdən peyğəmbərin ümmətin ən xırda məsələlərini də fikirləşib, bu haqda hökmlər verib, çirkin əməlləri onlara qadağan etməsi, hətta qadınların zinətlərinə və libaslarına da diqqət etdiyi məlum olur. Heyf, çox heyf, ümmət belə alicənabın əmrlərini tərk edib, öz nəfsani arzularına tabe olub, bu çirkin adətlərini islama daxil olandan sonra da mühafizə etməklə, bu adətləri islam ehkamı zənn edirlər və halbuki bizdə mövcud olan adətlər tamamilə islama ziddir. Bu cür yanlışlıqların hamısı Qurani-Şərifi və hədisləri bilməməkdən qaynaqlanır. Qurani-Şərifi anlamağı ancaq imamlara məxsus edib, hədisləri də*

لِلْفُقَرَآءِ الْمُهَاجِرِينَ الَّذِينَ اُخْرِجُوا مِنْ دِيَارِهِمْ وَاَمْوَالِهِمْ يَبْتَغُونَ فَضْلًا مِنَ اللهِ وَرِضْوَانًا وَيَنْصُرُونَ اللهَ وَرَسُولَهُ اُولٰٓئِكَ هُمُ الصَّادِقُونَ ﴿٨﴾ وَالَّذِينَ تَبَوَّؤُ الدَّارَ وَالْاِيمَانَ مِنْ قَبْلِهِمْ يُحِبُّونَ مَنْ هَاجَرَ اِلَيْهِمْ وَلَا يَجِدُونَ فِي صُدُورِهِمْ حَاجَةً مِمَّآ اُوتُوا

---

*etibarsız hesab edəndən sonra əlbəttə, müsəlmanlar arasında cəhalət və elmsizlik yayılacaqdır. Necə ki, bu günkü gündə biz müsəlmanların əhvalı cahiliyyə zamanında olanlardan daha da betərdir, desək doğru olar. Qurani-Şərifə və hədislərə diqqət etmək lazımdır. Din və dünya işlərinə dair elə bir məsələ yoxdur ki, o haqda Qurani-Şərif və uca peyğəmbərimiz bizə xəbər verməsin).*

**Allahın Rəsulu (ə.s) Bəni-Nəzir camaatından hasil olan qəniməti mühacirlərə verdi, çünki onlar bütün var-dövlətlərini Məkkədə qoyub, hicrət edib, yoxsullaşmışdılar. Ənsardan ancaq üç nəfərə o qənimətdən pay verdi: 1) Əbu Dücanə Səmmak İbn Xareşə, 2) Səhl ibn Hüneyf, 3) Haris ibn Sammə. Bu üç nəfərdən başqa ənsardan heç kimə qənimət payı vermədi. Ondan sonra ənsara buyurdu: "Əgər istəyirsinizsə, o qənimətdə mühacirlərə şərik olun. Lakin gərək mal-mülkünüzdən mühacirlərə bir hissə verəsiniz. Ya da əgər istəyirsinizsə, mal-mülkünüz sizin olsun, daha bu qənimətdən sizə bir şey çatmaz. Ənsar dedi: "Ey peyğəmbər, bəlkə biz mal-mülkümüzdən bir hissə mühacirlərə verib, qəniməti də onlara həvalə edib, onlardan bir şey istəməyək? Bu barədə növbəti ayə nazil oldu. Bəli, bir-birləri ilə belə qardaşlıq edib, güzəşt etməklə islamı tərəqqi etdirib, dünyanın əksər hissəsinə malik oldular.**

**8) (لِلْفُقَرَآءِ الْمُهَاجِرِينَ الَّذِينَ اُخْرِجُوا مِنْ دِيَارِهِمْ وَاَمْوَالِهِمْ)** (Bəni-Nəzir) **camaatının qənimətinin peyğəmbərə məxsus olması və peyğəmbərin o qəniməti kasıb mühacirlərə verməsinin səbəbi o idi ki, Məkkə müşrikləri onları yurdlarından çıxarıb, mallarını, hər bir şeylərini almışdılar.**

**(يَبْتَغُونَ فَضْلًا مِنَ اللهِ وَرِضْوَانًا وَيَنْصُرُونَ اللهَ وَرَسُولَهُ) - Bununla belə Allah-Təalanın məmnunluğunu və rəhmətini arzu edib, Allah-Təalaya və onun peyğəmbərinə kömək edirlər. (اُولٰٓئِكَ هُمُ الصَّادِقُونَ) - Bu mühacirlər iman və cihadlarında sadiq olanlardır.**

**9) (وَالَّذِينَ تَبَوَّؤُ الدَّارَ وَالْاِيمَانَ مِنْ قَبْلِهِمْ يُحِبُّونَ مَنْ هَاجَرَ اِلَيْهِمْ) - Və o şəxslər** (Ənsar) **ki, mühacirlərdən əvvəl Mədinəni özlərinə vətən edib, imanlarını Allaha məxsus ediblər, onların tərəfinə hicrət edib gələn müsəlmanları sevərlər. (وَلَا يَجِدُونَ فِي صُدُورِهِمْ حَاجَةً مِمَّآ اُوتُوا) - Mühacirlərə verilən** (Bəni-Nəzir) **camaatının qənimətində tamahları olmayıb, o barədə qəlblərində bir qeyz, ya**

وَيُؤْثِرُونَ عَلٰٓى اَنْفُسِهِمْ وَلَوْ كَانَ بِهِمْ خَصَاصَةٌ ۜ وَمَنْ يُوقَ شُحَّ نَفْسِهٖ فَاُولٰٓئِكَ هُمُ الْمُفْلِحُونَ ۚ ﴿٩﴾
وَالَّذِينَ جَٓاؤُ۫ مِنْ بَعْدِهِمْ يَقُولُونَ رَبَّنَا اغْفِرْ لَنَا وَلِاِخْوَانِنَا الَّذِينَ سَبَقُونَا بِالْاِيمَانِ

---

**da bir həsəd olmadı. (وَيُؤْثِرُونَ عَلٰٓى اَنْفُسِهِمْ وَلَوْ كَانَ بِهِمْ خَصَاصَةٌ) Hərçənd ənsarın özlərinin var-dövlətə və evə ehtiyacları olsa da, mühacirləri özlərindən üstün sayıb, var-dövlət və evlərindən onlara da verirlər.***

**(*Qeyd:** *"Ənsar - Mədinə əhli islam dininə rəvac verib, peyğəmbərin əmrini yayıb, ona kömək edən, qüvvət verən bir camaatdır. Onların gözəl sifətlərindən biri "isar"dır, yəni şəxsin özünün bir şeyə ehtiyacı olduğu halda mömin qardaşını özündən üstün sayıb, o şeyi ona verməsinə "isar" deyilir. Ənsardan bir nəfərə qonaq gəldi. Bir balaca qızı var idi. Yemək az olduğuna görə qızı yatızdırıb, çırağı söndürüb, yeməyi qonağa verdi ki, qonaq onun yemək yemədiyini görməsin, Ənəs ibn Malik deyir: "Bir şəxs ənsardan kasıb bir kişiyə bir qoyun kəlləsi gətirdi. O kasıb başqa bir kasıbı düşünüb, özü möhtac olduğu halda kəlləni o kasıba göndərdi. O da başqa bir kasıba göndərdi. Bu şəkildə o qoyun kəlləsi doqquz nəfərin arasında dolanıb, axırda yenə birinci şəxsə gəlib çatdı. Əbu Yezid Bistami deyir: "Bəlx əhlindən bir cavan məndən soruşub dedi: "Sizdəki zöhd nədən ibarətdir? Dedim: "Nə zaman bir şey tapsaq, yeyərik, tapmasaq, səbir edərik. Cavan dedi: "Bizim Bəlxin köpəkləri belədir. Bir şey tapsalar yeyərlər, tapmasalar, səbir edərlər. Bizdə isə zöhd budur: "Nə zaman ki, bir şey tapmadıq, səbir edərik, elə ki, bir şey tapdıq, o şeyi başqa möhtac şəxsə verərik. Həqiqətən, islamın əsl qanunu belədir. Bundan gözəl xüsusiyyət ola bilməz. Birlik və ittifaq məhəbbətə səbəb olub, islamın tərəqisinə bais olan xüsusiyyətlərdir. İslamın ilk dövründə müsəlmanların halı belə idi. Elə ki, xudpəsəndlər nəfsani arzuları düşünüb, islam ümməti arasına təfriqə salıb, neçə məzhəb və neçə ayin ixtira edib, bidətlər yaratdılar, ondan sonra din və müsəlmanlar zəifləməyə başladılar, hətta bu zamanda quru nəfəsi qalan cansız bir xəstəyə döndülər. Görəsən, müsəlmanlar öz şanlı keçmiş günlərini bir də görəcəkmi? Bəli, ittifaq və birlik sayəsində mümkündür ki, olsun. Yardım Allahdandır və ona təvəkkül edirik).*

**(وَمَنْ يُوقَ شُحَّ نَفْسِهٖ فَاُولٰٓئِكَ هُمُ الْمُفْلِحُونَ) - Və kim ki, Allah yolunda xərcləməyə mane olmaqda nəfsinin tamahını, xəsisliyini saxlasa, xərcləməyə mane olmazsa, belə şəxslər xeyir və mənfəətə yetişib, hər bir şər və zərərdən nicat tapanlardır.**

**10) (وَالَّذِينَ جَٓاؤُ۫ مِنْ بَعْدِهِمْ يَقُولُونَ رَبَّنَا اغْفِرْ لَنَا وَلِاِخْوَانِنَا الَّذِينَ سَبَقُونَا بِالْاِيمَانِ) - Və o şəxslər ki, ilk mühacirlərdən sonra Məkkədən hicrət edib Mədinəyə gəldilər, onlar dua edib, dualarında belə deyirdilər: "Ey bizim* rəbbimiz, bizi və daha əvvəl iman etmələri səbəbi ilə bizdən öndə olan mömin qardaşlarımızı bağışla.**

وَلَا تَجْعَلْ فِي قُلُوبِنَا غِلًّا لِلَّذِينَ اٰمَنُوا رَبَّنَٓا اِنَّكَ رَؤُ۫فٌ رَح۪يمٌ ۟﴿١٠﴾ اَلَمْ تَرَ اِلَى الَّذ۪ينَ نَافَقُوا

---

(***Qeyd:** *Urvə ibn Zübeyr deyir: “Aişə mənə dedi: “Bacı oğlu, Allah-Təala müsəlmanlara peyğəmbərin səhabələrindən ötrü Allahdan əfv istəmələrini əmr edibdir. Lakin bunun əvəzinə onları söyürlər. Malik İbn Miğvəl deyir: Şə`bi dedi: “Ya Malik, xristian və yəhudilər bircə xislətləri səbəbi ilə rafizilərdən (radikal şiə) fəzilətlidirlər. Yəhudilərdən soruşduqda ki, sizin millətinizin ən fəzilətliləri kimdir? Onlar da deyirlər: “Musa peyğəmbərin səhabəsidir. Xristianlardan soruşduqda ki, sizin ən fəzilətliniz kimdir? Onlar da deyirlər: “İsanın həvariləridir. Amma rafizidən soruşanda ki, sizin ümmətin şəriri və pisi kimdir? Deyirlər: “Məhəmmədin səhabələridir, halbuki onlardan ötrü Allahdan əfv istəməklə əmr olunublar. Bunun əvəzində söyürlər. Həqiqətən, necə ki, Şə`bi deyib, etdir. Abdullah ibn Müfəzzəl belə deyir: “Eşitdim ki, peyğəmbər buyurubdur: “Allah-Təalanı düşünüb, mənim səhabələrim haqqında çirkin sözlər deməyin. Kim ki, məndən sonra səhabələrimi sevsə, mənə görə onları sevibdir və kim ki, onlara düşmən olsa, yenə mənə görə onlara düşmən olubdur. (Yəni mənim səhabələrimi sevmək məni sevmək, onlara düşmən olmaq mənə düşmən olmaq deməkdir) və hər bir şəxs mənim səhabələrimə əziyyət etsə, həqiqətən mənə əziyyət edibdir və kim ki, mənə əziyyət etsə, həqiqətən, Allah-Təalaya əziyyət eləmiş olar. Belə şəxsə də Allah-Təala dərhal əzab edər. İbn Abbas bir nəfərin səhabələri söydüyünü görüb dedi: “Sən ilk mühacirlərdənsən? O şəxs dedi: xeyr. Dedi: “Ənsardansan? Dedi: xeyr. İbn Abbas dedi: “Mən şəhadət edirəm ki, sən onlara gözəl şəkildə tabe olanlardan deyilsən. Zeyd ibn Əli ibn Hüseyn Kufədə üsyan edib, Kufə əhlini özünə yardım etməyə dəvət etdi. Kufə əhli dedilər: “Sənə bir şərtlə kömək edərik ki, peyğəmbərin səhabələrindən Əbu Bəkri və Öməri söyəsən. Zeyd dedi: “Mən heç vaxt babamın iki vəzirini söymərəm. Kufə əhli ona kömək etmədilər və bu səbəbdən rafizi adlandılar. Rafizi tərk mənasınadır, yəni Zeydə yardım etməyi tərk etdilər).*

**(وَلَا تَجْعَلْ فِي قُلُوبِنَا غِلًّا لِلَّذ۪ينَ اٰمَنُوا) Ey bizim rəbbimiz, bizim qəlblərimizdə möminlərə qarşı kin və ədavət yaratma. (رَبَّنَٓا اِنَّكَ رَؤُ۫فٌ رَح۪يمٌ) Ey bizim rəbbimiz, həqiqətən, sən tövbə edənlərə qarşı mehriban və rəhm edənsən.** (Mədinədə olan münafiqlərin rəhbəri Abdullah ibn Übeyy ibn Səlul peyğəmbərin qoşunu Bəni-Nəzir yəhudilərini mühasirəyə salanda onlara xəbər göndərdi ki, qalanızda möhkəm durub, çıxmayın, savaşın, biz də sizə kömək edib, savaşacağıq. Əgər qaladan çıxsanız, biz də sizinlə birlikdə çıxacağıq. Bu barədə növbəti ayə nazil olub onları təkzib edir).

**11) (اَلَمْ تَرَ اِلَى الَّذ۪ينَ نَافَقُوا)** - (Ey Məhəmməd), **bəs münafiqlərə** (Abdullah Übeyy və onun yoldaşlarına) **baxıb, təəccüb etmirsən?**

يَقُولُونَ لِاِخْوَانِهِمُ الَّذِينَ كَفَرُوا مِنْ اَهْلِ الْكِتَابِ لَئِنْ اُخْرِجْتُمْ لَنَخْرُجَنَّ مَعَكُمْ وَلَا نُطِيعُ فِيكُمْ
اَحَدًا اَبَدًاۙ وَاِنْ قُوتِلْتُمْ لَنَنْصُرَنَّكُمْۜ وَاللّٰهُ يَشْهَدُ اِنَّهُمْ لَكَاذِبُونَ ﴿١١﴾ لَئِنْ اُخْرِجُوا لَا يَخْرُجُونَ مَعَهُمْ
ۚ وَلَئِنْ قُوتِلُوا لَا يَنْصُرُونَهُمْ ۚ وَلَئِنْ نَصَرُوهُمْ لَيُوَلُّنَّ الْاَدْبَارَ ۠ ثُمَّ لَا يُنْصَرُونَ ﴿١٢﴾ لَاَنْتُمْ اَشَدُّ
رَهْبَةً فِي صُدُورِهِمْ مِنَ اللّٰهِۜ ذٰلِكَ بِاَنَّهُمْ قَوْمٌ لَا يَفْقَهُونَ ﴿١٣﴾ لَا يُقَاتِلُونَكُمْ جَمِيعًا اِلَّا فِي قُرًى
مُحَصَّنَةٍ اَوْ مِنْ وَرَٓاءِ جُدُرٍۜ بَاْسُهُمْ بَيْنَهُمْ شَدِيدٌۜ تَحْسَبُهُمْ جَمِيعًا وَقُلُوبُهُمْ شَتّٰىۜ ذٰلِكَ بِاَنَّهُمْ قَوْمٌ لَا
يَعْقِلُونَۚ ﴿١٤﴾

---

(يَقُولُونَ لِاِخْوَانِهِمُ الَّذِينَ كَفَرُوا مِنْ اَهْلِ الْكِتَابِ) **Küfr və nifaqda qardaşlarına** (Bəni-Nəzir camaatına) **deyirlər: (لَئِنْ اُخْرِجْتُمْ لَنَخْرُجَنَّ مَعَكُمْ) - Əgər sizi yurdlarınızdan çıxartsalar, biz də sizinlə birlikdə çıxarıq. (وَلَا نُطِيعُ فِيكُمْ اَحَدًا اَبَدًا) Sizin əleyhinizə savaşmaqda heç kimə itaət etməyib, sizinlə də savaşmarıq.**

**(وَاِنْ قُوتِلْتُمْ لَنَنْصُرَنَّكُمْ) - Əgər sizinlə savaşsalar, əlbəttə sizə kömək edərik.**

**(وَاللّٰهُ يَشْهَدُ اِنَّهُمْ لَكَاذِبُونَ)** - (Ey Məhəmməd), **Allah-Təala şəhadət edir ki, həqiqətən, münafiqlər** (Bəni-Nəzir) **camaatına verdikləri vədlərində yalançıdırlar. Onlara kömək edən deyillər.**

**12) (لَئِنْ اُخْرِجُوا لَا يَخْرُجُونَ مَعَهُمْ)** - (Ey Məhəmməd), **əgər Bəni-Nəzir camaatını** (yurdlarından) **çıxartsanız, bu münafiqlər onlarla birlikdə çıxmazlar. (وَلَئِنْ قُوتِلُوا لَا يَنْصُرُونَهُمْ ۚ وَلَئِنْ نَصَرُوهُمْ لَيُوَلُّنَّ الْاَدْبَارَ ۠ ثُمَّ لَا يُنْصَرُونَ) - Əgər onlarla savaşsanız, bu münafiqlər onlara kömək etməzlər. Əgər bir ehtimal, kömək edib, savaşsalar da, müqavimət göstərməyib, arxa çevirib qaçarlar. Ondan sonra onların nifaqları məlum olduğuna görə daha o münafiqlərə heç bir kömək edən olmaz.**

**13) (لَاَنْتُمْ اَشَدُّ رَهْبَةً فِي صُدُورِهِمْ مِنَ اللّٰهِ) - İnsanlar gərək Allah-Təaladan qorxsunlar. Amma münafiqlər Haqqa etiqad etməyir, onların qəlblərində Allah-Təaladan çox sizin qorxunuzdur. (ذٰلِكَ بِاَنَّهُمْ قَوْمٌ لَا يَفْقَهُونَ) - Onların Allah-Təaladan qorxusuz olmaları o səbəbədir ki, onlar cahil və nadan camaatdırlar. Allah-Təalanın əzəmətinə agah olmadıqları üçün Allah-Təaladan yox, sizdən qorxurlar.**

**14) (لَا يُقَاتِلُونَكُمْ جَمِيعًا اِلَّا فِي قُرًى مُحَصَّنَةٍ اَوْ مِنْ وَرَٓاءِ جُدُرٍ) Ey müsəlmanlar, yəhudi və münafiqlər möhkəm şəhərlərdə və ya divarların arxasında olmadan ittifaq edib sizinlə savaşa bilməzlər və hətta cürət edib sizinlə savaş meydanına çıxa bilməzlər. (بَاْسُهُمْ بَيْنَهُمْ شَدِيدٌ تَحْسَبُهُمْ جَمِيعًا وَقُلُوبُهُمْ شَتّٰى) - Öz aralarında savaşarkən onların şücaətləri çox və möhkəmdir. Lakin sizinlə savaşanda onlarda o şücaət qalmayıb, zəif olarlar.** (Ey Məhəmməd), **sən onları birlikdə və müttəfiq zənn edirsən, amma onların qəlbləri dağınıqdır, bir-birləri ilə birlikləri və dostluqları yoxdur. Onlardan qorxmayın. (ذٰلِكَ بِاَنَّهُمْ قَوْمٌ لَا يَعْقِلُونَ) - Bunun səbəbi odur ki, yəhudilər və münafiqlər həqi-**

كَمَثَلِ الَّذِينَ مِنْ قَبْلِهِمْ قَرِيبًا ذَاقُوا وَبَالَ اَمْرِهِمْ ۚ وَلَهُمْ عَذَابٌ اَلِيمٌ ۚ ﴿١٥﴾ كَمَثَلِ الشَّيْطَانِ اِذْ قَالَ لِلْاِنْسَانِ اكْفُرْ ۚ فَلَمَّا كَفَرَ قَالَ اِنِّي بَرِيٓءٌ مِنْكَ اِنِّيٓ اَخَافُ اللّٰهَ رَبَّ الْعَالَمِينَ ﴿١٦﴾ فَكَانَ عَاقِبَتَهُمَآ اَنَّهُمَا فِي النَّارِ خَالِدَيْنِ فِيهَاۜ وَذٰلِكَ جَزٰٓؤُا الظَّالِمِينَ ۚ ﴿١٧﴾ يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا اتَّقُوا اللّٰهَ وَلْتَنْظُرْ نَفْسٌ مَا قَدَّمَتْ لِغَدٍۚ وَاتَّقُوا اللّٰهَ ۜ اِنَّ اللّٰهَ خَبِيرٌ بِمَا تَعْمَلُونَ ﴿١٨﴾ وَلَا تَكُونُوا كَالَّذِينَ نَسُوا اللّٰهَ فَاَنْسٰيهُمْ اَنْفُسَهُمْ ۜ اُو۬لٰٓئِكَ هُمُ الْفَاسِقُونَ﴿١٩﴾ لَا يَسْتَوِيٓ اَصْحَابُ النَّارِ وَاَصْحَابُ الْجَنَّةِۜ اَصْحَابُ الْجَنَّةِ هُمُ الْفَٓائِزُونَ ﴿٢٠﴾

---

**qətən, cahil bir camaatdırlar. Bilmirlər ki, qəlblərinin dağınıq olması onların qüvvələrini zəiflədib, savaşda aciz olarlar.**

**15) (كَمَثَلِ الَّذِينَ مِنْ قَبْلِهِمْ قَرِيبًا ذَاقُوا وَبَالَ اَمْرِهِمْ ۚ وَلَهُمْ عَذَابٌ اَلِيمٌ) - Bu yəhudi və münafiqlərin məsəli onlardan əvvəl yaxın zamanda keçən** (Bədir) **əhlinin məsəli kimidir. Dünyada əməllərinin əzabını dadıb, öldürüldülər. Axirətdə də onlardan ötrü əziyyət verən əzab vardır.**

**16) (كَمَثَلِ الشَّيْطَانِ اِذْ قَالَ لِلْاِنْسَانِ اكْفُرْ) -** (Ey Məhəmməd), **münafiqlərin məsəli** (Bəni-Nəzir) **camaatı ilə şeytanın məsəli kimidir. O zaman ki, insana vəsvəsə edib dedi:**

**Allah-Təalaya kafir ol. (فَلَمَّا كَفَرَ قَالَ اِنِّي بَرِيٓءٌ مِنْكَ اِنِّيٓ اَخَافُ اللّٰهَ رَبَّ الْعَالَمِينَ) - O zaman ki, insan şeytanın vəsvəsəsinə tabe olub kafir oldu, o vaxt şeytan deyər: "Həqiqətən, mən səndən bezmişəm, həqiqətən, mən aləmlərin rəbbi, tərbiyə verəni Allah-Təaladan qorxuram.**

**17) (فَكَانَ عَاقِبَتَهُمَآ اَنَّهُمَا فِي النَّارِ خَالِدَيْنِ فِيهَاۜ وَذٰلِكَ جَزٰٓؤُا الظَّالِمِينَ) -** (Ey Məhəmməd), **şeytanın, ona itaət edənlərin axırı bu oldu ki, həqiqətən, cəhənnəm odunda həmişəlik qalacaqlar. Zalımların cəzası budur. Onlara belə cəza verilir.**

**18) (يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا اتَّقُوا اللّٰهَ وَلْتَنْظُرْ نَفْسٌ مَا قَدَّمَتْ لِغَدٍۚ) Ey iman edənlər, Allah-Təaladan qorxan hər bir nəfs baxıb görsün ki, sabahkı gündən** (qiyamət günündən) **ötrü nə xeyir əməl göndəribdir? (وَاتَّقُوا اللّٰهَ ۜ اِنَّ اللّٰهَ خَبِيرٌ بِمَا تَعْمَلُونَ) Əlbəttə, Allah-Təaladan qorxub, xeyir əməllərə yönəlin. Həqiqətən, Allah-Təala sizin əməllərinizə agah və xəbərdardır. Əməllərinizə müqabil sizə qarşılıq verəcəkdir.**

**19) ( وَلَا تَكُونُوا كَالَّذِينَ نَسُوا اللّٰهَ فَاَنْسٰيهُمْ اَنْفُسَهُمْ ۜ اُو۬لٰٓئِكَ هُمُ الْفَاسِقُونَ ) Ey möminlər, siz o şəxslər kimi olmayın ki, Allah-Təalanı unudub, Allah da onlara öz nəfslərini unutdurub, özlərinin xeyir və mənfəəti üçün heç bir şey etmirlər ki, axirətdə onlara əzabdan nicat versin və bu səbəbdən onlar fasiq camaatdırlar.**

**20) (لَا يَسْتَوِيٓ اَصْحَابُ النَّارِ وَاَصْحَابُ الْجَنَّةِۜ اَصْحَابُ الْجَنَّةِ هُمُ الْفَٓائِزُونَ) - Cəhənnəm əhli ilə cənnət əhli (kafirlə mömin) bərabər olmazlar. Hər bir xeyrə və böyük savablara yetişən cənnət əhlidir, nəinki cəhənnəm əhli.**

لَوْ اَنْزَلْنَا هٰذَا الْقُرْاٰنَ عَلٰى جَبَلٍ لَرَاَيْتَهُ خَاشِعًا مُتَصَدِّعًا مِنْ خَشْيَةِ اللّٰهِ وَتِلْكَ الْاَمْثَالُ نَضْرِبُهَا لِلنَّاسِ
لَعَلَّهُمْ يَتَفَكَّرُونَ ﴿٢١﴾ هُوَ اللّٰهُ الَّذ۪ي لَٓا اِلٰهَ اِلَّا هُوَۚ عَالِمُ الْغَيْبِ وَالشَّهَادَةِۚ هُوَ الرَّحْمٰنُ الرَّح۪يمُ
﴿٢٢﴾ هُوَ اللّٰهُ الَّذ۪ي لَٓا اِلٰهَ اِلَّا هُوَۚ اَلْمَلِكُ الْقُدُّوسُ السَّلَامُ الْمُؤْمِنُ الْمُهَيْمِنُ الْعَز۪يزُ الْجَبَّارُ الْمُتَكَبِّرُۜ
سُبْحَانَ اللّٰهِ عَمَّا يُشْرِكُونَ ﴿٢٣﴾ هُوَ اللّٰهُ الْخَالِقُ الْبَارِئُ الْمُصَوِّرُ لَهُ الْاَسْمَٓاءُ الْحُسْنٰىۜ يُسَبِّحُ لَهُ مَا
فِي السَّمٰوَاتِ وَالْاَرْضِۚ وَهُوَ الْعَز۪يزُ الْحَك۪يمُ ﴿٢٤﴾

---

**21)** (لَوْ اَنْزَلْنَا هٰذَا الْقُرْاٰنَ عَلٰى جَبَلٍ لَرَاَيْتَهُ خَاشِعًا مُتَصَدِّعًا مِنْ خَشْيَةِ اللّٰهِ) - (Ey Məhəmməd), **əgər biz Quranı əgər bir dağa nazil etsəydik, hər halda o dağı möhkəm və sabit olmasına baxmayaraq Allah-Təalanın qorxusundan yıxılıb, parça-parça olub dağıldığını görərdin.** (Ayə Qurani-Şərifin ayələrini düşünməyən insan qəlbinin qatılığını və dağlardan sərt olduğunu misal çəkməklə belə insanın cansız maddədən də aşağı səviyyədə olduğunu göstərir. Necə ki, ayənin sonu bu mətləbə açıq-aşkar dəlildir). (وَتِلْكَ الْاَمْثَالُ نَضْرِبُهَا لِلنَّاسِ لَعَلَّهُمْ يَتَفَكَّرُونَ) - **(Ey Məhəmməd), belə məsəlləri insanlardan ötrü bəyan edirik ki, bu məsəldən məqsədin nə olduğuna fikir verib, həqiqəti dərk edib kafir və münafiqlərin qatılığına və fəsadına agah olsunlar.** (Bundan sonra növbəti ayələrdə Allah-Təala öz əzəmət və cəlalına işarə edən sifətləri bəyan edir).

**22)** (هُوَ اللّٰهُ الَّذ۪ي لَٓا اِلٰهَ اِلَّا هُوَۚ عَالِمُ الْغَيْبِ وَالشَّهَادَةِۚ هُوَ الرَّحْمٰنُ الرَّح۪يمُ) **Qeybi və aşkarı bilib, dünya və axirətdə rəhm edən yeganə Allah-Təaladır ki, ondan başqa ibadətə layiq heç bir haqq olan məbud yoxdur.**

**23)** (هُوَ اللّٰهُ الَّذ۪ي لَٓا اِلٰهَ اِلَّا هُوَۚ اَلْمَلِكُ الْقُدُّوسُ السَّلَامُ الْمُؤْمِنُ الْمُهَيْمِنُ الْعَز۪يزُ الْجَبَّارُ الْمُتَكَبِّرُۜ سُبْحَانَ اللّٰهِ عَمَّا يُشْرِكُونَ)

**O, elə bir Allah-Təaladır ki, insanların maliki və çirkinliklərdən müqəddəsdir və insanlar onun zülmündən salamat və əmin-amandadır, insanların hər bir işinə nəzarət edəndir və bütün məxluqata qalibdir və hamısından ucadır, ondan başqa bütün məxluqat onun yanında zəlildir, böyük və yeganədir, ondan başqa ibadətə layiq heç bir haqq olan məbud yoxdur. İnsanların ona şərik qoşduğu şeylərdən pak və ucadır və heç bir şey ona şərik olmağa layiq deyildir.**

**24)** (هُوَ اللّٰهُ الْخَالِقُ الْبَارِئُ الْمُصَوِّرُ) **- O, hər şeyi yoxdan meydana gətirib yaradan, insanlara müxtəlif şəkillərdə surət verən Allah-Təaladır.**

(لَهُ الْاَسْمَٓاءُ الْحُسْنٰىۜ) **Uca sifətlərə işarə edən hər bir gözəl ad Allah-Təalaya məxsusdur.** (يُسَبِّحُ لَهُ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِۚ وَهُوَ الْعَز۪يزُ الْحَك۪يمُ) **Göylərdə və yerdə olan məxluqat varlıqları ilə Allah-Təalanı təqdis edib, pak sayıb, ona sitayiş edirlər. O, məxluqata qalib, hər bir işini hikmət üzrə təqdir edən Allah-Təaladır.**

**Allaha həmd olsun, əl-Həşr surəsinin təfsiri tamamlandı. Əbu Hüreyrə demişdir: "Allahın Rəsulundan "ismi-əzəm"i** (Allahın ən böyük adını) soruşdum, buyurdu ki, əl-Həşr surəsinin axırı "ismi-əzəm"dir, onu çox oxu. Yenidən soruşdum, həmin cavabı verdi, təkrar soruşdum, yenə eyni cavabı verdi. Allahın Rəsulu buyurdu: "Kim əl-Həşr surəsini oxusa, tövbə etməsi şərti ilə Allah-Təala onun günahlarını bağışlayar)".

# əl-MÜMTƏHİNƏ SURƏSİ

60-cı surədir. Mədinədə nazil olub, 13 ayə, 348 kəlmə və 1510 hərfdir.

**Bismillahir-Rəhmanir-Rəhim**

Əbu Əmr ibn Seyfi ibn Hişam ibn Əbdi-Manafın Sara adlı kənizi peyğəmbər Məkkənin fəthinə hazırlaşarkən Mədinəyə, peyğəmbərin hüzuruna gəldi. Allahın Rəsulu soruşdu: "Müsəlman kimi gəlibsən? Dedi: xeyr. Soruşdu: "Hicrət edib, gəlibsən? Dedi: xeyir. Təkrar soruşdu: "Bəs səni buraya nə gətiribdir? Sara dedi: "Siz mənim əhlim və ağalarım idiniz. Məkkədəki ağalarım getdilər. (Yəni Bədirdə öldürüldülər), son dərəcə möhtac vəziyyətə düşmüşəm. Sizə gəlmişəm ki, mənə yemək və libas verəsiniz. Bu qadın müğənni olduğuna görə peyğəmbər soruşdu: "Məkkənin cavanları necə oldular?" Qadın dedi: "Bədir savaşından sonra məndən bir şey (yəni mahnı) istəyən yoxdur. Allahın Rəsulu Əbdülmuttəlib övladlarını təşviq edib, onlar da o qadına kömək edib, ona libas və ərzaq üçün pul və minmək üçün minik verdilər. Səhabələrdən Hatib ibn Əbi Bəltə Saranın yanına gedib, ona bir kağız və 10 qızıl dinar verib dedi: "Bu kağızı Məkkədə Qüreyşə çatdır. (Bu kişi Qüreyş camaatından deyildi, lakin Qüreyşin Bəni-Əsəd camaatı ilə andlı müttəfiq idi). Kağızın məzmunu belə idi: "Bu kağız Hatib ibn Əbi Bəltədən Məkkə əhlinədir, xəbərdar olun ki, Allahın Rəsulu sizə gəlir. Ehtiyatlı olub, hazırlaşın. Sara pulu və kağızı alıb yola düşdü. Peyğəmbər Əlini, Əmmarı, Təlhəni, Zübeyri, Miqdad ibn Əsvədi və Əbu Mərsədi) çağırıb dedi: "Tez minib, Xaxdakı bağa gedin. Orada bir qadın görəcəksiniz. Onda Hatib ibn Əbi Bəltədən Məkkə əhlinə bir kağız vardır. Kağızı ondan alıb, özünü buraxın getsin. Onlar yola düşüb, Həmra-ül-əsəd yaxınlığında Xax bağına yetişib Saranı orada tapdılar. Ondan kağızı istədilər. İnkar etdi. Əşyalarını axtarıb tapmadılar. İstədilər Mədinəyə qayıtsınlar. Əli ibn Əbu Talib dedi: "And olsun Allah-Təalaya, Allahın Rəsulu yalan deməyibdir. Qılıncı çəkib dedi: "Kağızı ver, ya da gərək başını qoparam. Sara məcbur qalıb, kağızı baş saçının içindən çıxartdı. Kağızı alıb Mədinəyə qayıtdılar. Allahın Rəsulu kağızın məzmunundan agah olub, Hatibi gətirmələrini əmr etdi. Hatibi gətirdilər. Soruşdu: "Bu kağızı yazmağa səni nə vadar etdi? Hatib dedi: "Ey peyğəmbər, müsəlman olduqdan sonra kafir olmamışam, sənə qarşı hiylə etməmişəm. Məkkə əhlindən ayrılandan sonra onlarla dostluq etməmişəm, lakin mən qərib bir kişiyəm, Qüreyşdən deyiləm, özümü onlara nisbət etmişəm.

Məndən başqa sənin hüzurunda olan mühacirlərin hamısının Məkkədə qohumları var. Onların mallarını və ailələrini mühafizə edirlər. Mən

يَآ اَيُّهَا الَّذٖينَ اٰمَنُوا لَا تَتَّخِذُوا عَدُوّٖي وَعَدُوَّكُمْ اَوْلِيَآءَ تُلْقُونَ اِلَيْهِمْ بِالْمَوَدَّةِ وَقَدْ كَفَرُوا بِمَا جَٓاءَكُمْ
مِنَ الْحَقِّۚ يُخْرِجُونَ الرَّسُولَ وَاِيَّاكُمْ اَنْ تُؤْمِنُوا بِاللّٰهِ رَبِّكُمْۜ اِنْ كُنْتُمْ خَرَجْتُمْ جِهَادًا فٖي سَبٖيلٖي
وَابْتِغَٓاءَ مَرْضَاتٖي تُسِرُّونَ اِلَيْهِمْ بِالْمَوَدَّةِۗ وَاَنَا۬ اَعْلَمُ بِمَٓا اَخْفَيْتُمْ وَمَٓا اَعْلَنْتُمْۜ وَمَنْ يَفْعَلْهُ مِنْكُمْ فَقَدْ
ضَلَّ سَوَٓاءَ السَّبٖيلِ ﴿١﴾ اِنْ يَثْقَفُوكُمْ يَكُونُوا لَكُمْ اَعْدَٓاءً وَيَبْسُطُوٓا اِلَيْكُمْ اَيْدِيَهُمْ وَاَلْسِنَتَهُمْ بِالسُّٓوءِ
وَوَدُّوا لَوْ تَكْفُرُونَۜ ﴿٢﴾

---

Məkkədəki ailəm üçün qorxuram, bu kağızı yazmaqdan məqsədim Qüreyşə bir xidmət göstərib, əvəzində ailəmi onlardan qorumaqdır. Halbuki bilirəm ki, Allah-Təala onlara öz əzabını göndərib, mənim kağızım onlara heç bir fayda verməyəcəkdir. Peyğəmbər onu təsdiq edib, üzrxahlığını qəbul etdi. Ömər ibn Xəttab durub dedi: "Ey peyğəmbər, izin ver, bu münafiqin boynunu vurum. Buyurdu: "Ey Ömər, sənə nə bildirildi? (Yəni bilmirsən). Allah-Təala Bədirdə cihad edənlərə buyurubdur: "Nə istəyirsiniz, edin, həqiqətən sizi bağışlamışam. Ömərin gözlərindən yaş axıb dedi: "Allah-Təala və onun peyğəmbəri elm sahibidirlər. Hatib Bədirdə olanlardan idi. O vaxt gələn surənin əvvəlindəki bir neçə ayə Hitab ibn Əbi Bəltə haqqında nazil oldu.

**1) (يَآ اَيُّهَا الَّذٖينَ اٰمَنُوا لَا تَتَّخِذُوا عَدُوّٖي وَعَدُوَّكُمْ اَوْلِيَآءَ) Ey möminlər, mənim və sizin düşmənlərinizi (müşrikləri) özünüzə dost etməyin.** (Necə ki, Hatib ibn Əbi Bəltə etdi). **(تُلْقُونَ اِلَيْهِمْ بِالْمَوَدَّةِ وَقَدْ كَفَرُوا بِمَا جَٓاءَكُمْ مِنَ الْحَقِّ) - Düşmənlərə məhəbbət bəsləyib, (kağız yazmaqla) dostluğunuzu bildirirsiniz, halbuki onlar sizə gələnə** (Qurana) **kafir olublar. Elə şəxsləri necə dost edirsiniz?**

**(يُخْرِجُونَ الرَّسُولَ وَاِيَّاكُمْ اَنْ تُؤْمِنُوا بِاللّٰهِ رَبِّكُمْۜ) - Məkkə əhli peyğəmbəri və sizi rəbbiniz Allah-Təalaya iman etdiyiniz üçün Məkkədən çıxartdılar.**

**(اِنْ كُنْتُمْ خَرَجْتُمْ جِهَادًا فٖي سَبٖيلٖي وَابْتِغَٓاءَ مَرْضَاتٖي) Ey möminlər, əgər mənim yolumda cihad edib, mənim məmnunluğumu qazanmaq üçün hicrət edib Məkkədən çıxıbsınızsa, mənim və sizin düşməninizlə dostluq etməyin. (تُسِرُّونَ اِلَيْهِمْ بِالْمَوَدَّةِۗ وَاَنَا۬ اَعْلَمُ بِمَٓا اَخْفَيْتُمْ وَمَٓا اَعْلَنْتُمْۜ) Düşmənlərə gizlincə məhəbbətinizi bildirirsiniz, bunda sizə nə fayda vardır, halbuki mən sizin gizlin və aşkar işlərinizin hamısına ağaham. Daha düşmənlərə gizlincə məhəbbət bildirmək niyə lazımdır? (وَمَنْ يَفْعَلْهُ مِنْكُمْ فَقَدْ ضَلَّ سَوَٓاءَ السَّبٖيلِ) Sizlərdən kim ki, belə əməllərə qurşansa, həqiqətən düz və haqq yoldan kənar olub asi olubdur.**

**2-3) (اِنْ يَثْقَفُوكُمْ يَكُونُوا لَكُمْ اَعْدَٓاءً وَيَبْسُطُوٓا اِلَيْكُمْ اَيْدِيَهُمْ وَاَلْسِنَتَهُمْ بِالسُّٓوءِ وَوَدُّوا لَوْ تَكْفُرُونَ) Ey möminlər, o müşriklərə ki, məhəbbətinizi bildirirsiniz, əgər onlar sizi ələ keçirsələr, o vaxt sizə xalis düşmən olub, göstərdiyiniz məhəbbəti nəzərə almayıb, əllərini savaşmaq, dillərini də söymək üçün sizə uzadıb, heç bir əzabı sizdən əsirgəməyəcəklər. Sizə əzab etməmək üçün kafir olmanızı istəyəcəklər. Bəs imandan sonra kafir olmaq olarmı?**

لَنْ تَنْفَعَكُمْ اَرْحَامُكُمْ وَلَٓا اَوْلَادُكُمْۚ يَوْمَ الْقِيٰمَةِۚ يَفْصِلُ بَيْنَكُمْۜ وَاللّٰهُ بِمَا تَعْمَلُونَ بَص۪يرٌ ﴿٣﴾ قَدْ
كَانَتْ لَكُمْ اُسْوَةٌ حَسَنَةٌ ف۪ٓي اِبْرٰه۪يمَ وَالَّذ۪ينَ مَعَهُۚ اِذْ قَالُوا لِقَوْمِهِمْ اِنَّا بُرَءٰٓؤُ۬ا مِنْكُمْ وَمِمَّا تَعْبُدُونَ
مِنْ دُونِ اللّٰهِۘ كَفَرْنَا بِكُمْ وَبَدَا بَيْنَنَا وَبَيْنَكُمُ الْعَدَاوَةُ وَالْبَغْضَٓاءُ اَبَدًا حَتّٰى تُؤْمِنُوا بِاللّٰهِ وَحْدَهُٓ اِلَّا قَوْلَ
اِبْرٰه۪يمَ لِاَب۪يهِ لَاَسْتَغْفِرَنَّ لَكَ وَمَٓا اَمْلِكُ لَكَ مِنَ اللّٰهِ مِنْ شَيْءٍۜ رَبَّنَا عَلَيْكَ تَوَكَّلْنَا وَاِلَيْكَ اَنَبْنَا وَاِلَيْكَ
الْمَص۪يرُ ﴿٤﴾

---

(لَنْ تَنْفَعَكُمْ اَرْحَامُكُمْ وَلَٓا اَوْلَادُكُمْۚ يَوْمَ الْقِيٰمَةِۚ يَفْصِلُ بَيْنَكُمْ) **Yaxın qohumlarınız və övladlarınızdan ötrü müşriklərə məhəbbətinizi bildirirsiniz, onlar isə sizə əbədiyyən fayda verməyəcəklər. Qiyamət günündə Allah-Təala sizi bir-birinizdən aralayıb, itaətkarları cənnətə, günahkarları cəhənnəmə daxil edəcəkdir.** (وَاللّٰهُ بِمَا تَعْمَلُونَ بَص۪يرٌ) **Allah-Təala sizin əməllərinizi görür və agahdır. Hər bir şəxsə öz əməlinə görə cəza verəcəkdir.**

**4)** (قَدْ كَانَتْ لَكُمْ اُسْوَةٌ حَسَنَةٌ ف۪ٓي اِبْرٰه۪يمَ وَالَّذ۪ينَ مَعَهُۚ) **Siz möminlərdən ötrü İbrahimə və onunla birlikdə Allah-Təalaya iman edənlərə gözəl şəkildə tabe olmaq nümunəsi vardır. Baxıb görün, onlar müşriklər ilə necə rəftar etdilər? Siz də elə rəftar edin.**

(اِذْ قَالُوا لِقَوْمِهِمْ اِنَّا بُرَءٰٓؤُ۬ا مِنْكُمْ وَمِمَّا تَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِۘ كَفَرْنَا بِكُمْ) **- İbrahim və möminlər öz qövmlərinə** (müşriklərə) **dedilər: "Həqiqətən, biz sizdən və Allah-Təaladan başqasına ibadət etdiyiniz bütlərdən uzaq olub, sizə kafir olduq, sizin məbudlarınıza etina etməyib, bizim yanımızda siz heç bir şeysiniz.** (Siz möminlər də gərək müşriklərə belə deyəsiniz, nəinki onlara məhəbbətinizi bildirib, kağız yazıb, onlarla dostluq edəsiniz).

(وَبَدَا بَيْنَنَا وَبَيْنَكُمُ الْعَدَاوَةُ وَالْبَغْضَٓاءُ اَبَدًا حَتّٰى تُؤْمِنُوا بِاللّٰهِ وَحْدَهُ) (İbrahim və möminlər deyir:) **bizimlə sizin aranızda həmişəlik ədavət və düşmənçilik meydana gəldi. Yeganə Allah-Təalaya iman edib, şirki tərk edincəyə qədər sizlərlə dost ola bilmərik. Siz möminlər də gərək belə deyəsiniz.**

(اِلَّا قَوْلَ اِبْرٰه۪يمَ لِاَب۪يهِ لَاَسْتَغْفِرَنَّ لَكَ) **Gərək İbrahimin hər bir sözünə tabe olasınız. Ancaq bircə sözünə tabe olmaq olmaz, hansı ki atasına demişdi: "Səndən ötrü Allahdan əfv istəyirəm. Bu sözdə İbrahimə tabe olmaq olmaz, İbrahimin atası müşrik olduğuna görə əfv istəməsi qəbul olunmadı.** (İbrahim atasına əfv ediləcəyi vədi vermişdi, vədinə vəfa edib, onun üçün əfv istədi. Buna görə də İbrahimin hər bir feil və sözünə tabe olmaq lazımdır, ancaq müşrikdən ötrü Allahdan əfv istəməkdə ona tabe olmaq caiz deyildir). (وَمَٓا اَمْلِكُ لَكَ مِنَ اللّٰهِ مِنْ شَيْءٍ) **- İbrahim atasına deyir: "Ey ata, gəl Allah-Təalaya iman et. Mən səndən ötrü Allah-Təaladan gələn bir şeyə** (əzabına mane olmağa) **qadir deyiləm. Mən səni Allah-Təalanın əzabından xilas edə bilmərəm.** (رَبَّنَا عَلَيْكَ تَوَكَّلْنَا وَاِلَيْكَ اَنَبْنَا وَاِلَيْكَ الْمَص۪يرُ) **Ey möminlər, dua məqamında**

رَبَّنَا لَا تَجْعَلْنَا فِتْنَةً لِلَّذِينَ كَفَرُوا وَاغْفِرْ لَنَا رَبَّنَاۚ اِنَّكَ اَنْتَ الْعَزِيزُ الْحَكِيمُ ﴿٥﴾ لَقَدْ كَانَ لَكُمْ فِيهِمْ
اُسْوَةٌ حَسَنَةٌ لِمَنْ كَانَ يَرْجُوا اللّٰهَ وَالْيَوْمَ الْاٰخِرَۜ وَمَنْ يَتَوَلَّ فَاِنَّ اللّٰهَ هُوَ الْغَنِيُّ الْحَمِيدُ ﴿٦﴾ عَسَى اللّٰهُ
اَنْ يَجْعَلَ بَيْنَكُمْ وَبَيْنَ الَّذِينَ عَادَيْتُمْ مِنْهُمْ مَوَدَّةًۜ وَاللّٰهُ قَدِيرٌۜ وَاللّٰهُ غَفُورٌ رَحِيمٌ ﴿٧﴾

---

**belə dua edib tövbə məqamına gəlib deyin: “Ey bizim rəbbimiz, hər bir işimizdə sənə təvəkkül edib, günahdan sənə dönüb sığındıq. Bütün məxluqların qayıdacağı yer sənin tərəfinədir.**

**5) (رَبَّنَا لَا تَجْعَلْنَا فِتْنَةً لِلَّذِينَ كَفَرُوا) Ey bizim rəbbimiz, kafirləri bizə hakim edib, bizi onlardan ötrü sınaq vasitəsi etmə ki, bizə əzab etsinlər.**

**(وَاغْفِرْ لَنَا رَبَّنَاۚ اِنَّكَ اَنْتَ الْعَزِيزُ الْحَكِيمُ) Ey bizim rəbbimiz, bizim günahlarımızı bağışla, həqiqətən, məxluqata qalib olub, onların hər bir işini hikmət üzrə təqdir edən sənsən.** (Növbəti ayədə cənab İbrahimə tabe olmağı yenidən təkid edir).

**6) (لَقَدْ كَانَ لَكُمْ فِيهِمْ اُسْوَةٌ حَسَنَةٌ) Həqiqətən, siz möminlərdən ötrü İbrahimə və onun davamçılarına gözəl şəkildə tabe olma nümunəsi var idi. Gərək siz onlara tabe olub müşriklərlə dostluq etməyəydiniz.**

**(لِمَنْ كَانَ يَرْجُوا اللّٰهَ وَالْيَوْمَ الْاٰخِرَ) - Bu tabe olmaq o şəxsdən ötrüdür ki, Allah-Təalanın rəhmətini və qiyamət gününü qarşılamağa ümidvar olmuş olsun. (وَمَنْ يَتَوَلَّ فَاِنَّ اللّٰهَ هُوَ الْغَنِيُّ الْحَمِيدُ) Kim ki, bizim əmrimizdən üz döndərib, kafir və müşriklərlə dostluq etsə, həqiqətən, Allah-Təala insanlardan ehtiyacsız və həmd-səna edilməyə layiqdir.** (Elə ki, bu ayələr nazil oldu, möminlər müşrik olan qohumlarına qarşı olan ədavətlərində möhkəm olub, qəlblərində onlara bəslədikləri gizli məhəbbəti yox etdilər. Lakin onların islama girmələrini Allahdan arzulayıb, istəyirdilər. Bu səbəbdən növbəti ayədə Allah-Təala onlara bunu vəd edib, Məkkənin fəthində arzularına çatdılar).

**7) (عَسَى اللّٰهُ اَنْ يَجْعَلَ بَيْنَكُمْ وَبَيْنَ الَّذِينَ عَادَيْتُمْ مِنْهُمْ مَوَدَّةًۜ وَاللّٰهُ قَدِيرٌۜ وَاللّٰهُ غَفُورٌ رَحِيمٌ) Ey möminlər, Allah-Təalanın sizinlə düşmən olduğunuz müşriklərin arasında** (islam şərti ilə)* **bir məhəbbət yaradacağına ümidvar olun. Ta ki, bir-birinizlə qaynayıb-qarışasınız.**

**(*Qeyd:** *“Qüreyş camaatından Abdullah ibn Cəhş müsəlman olub xanımı - Ümmü Həbibə Əbu Süfyan qızı ilə Məkkədən Həbəşistana hicrət etdi və yenə ondan başqa müsəlmanlar da müşriklərin qorxusundan hicrət etdilər. O cümlədən Osman ibn Əffan və Cəfər ibn Əbu Talib, cəmi səksən nəfər Həbəşistanda toplandılar. Abdullah ibn Cəhş orada vəfat etdi. Allahın Rəsulu Həbəşistan padşahı Nəcaşiyə qasid göndərib, onun vasitəsi ilə Ümmü Həbibə ilə evlənmək istədi. Nəcaşi Ümmü Həbibəni peyğəmbərdən ötrü istəyib, o da razı oldu. 400 dinara nikah müqaviləsi*

لَا يَنْهٰيكُمُ اللّٰهُ عَنِ الَّذِينَ لَمْ يُقَاتِلُوكُمْ فِي الدِّينِ وَلَمْ يُخْرِجُوكُمْ مِنْ دِيَارِكُمْ اَنْ تَبَرُّوهُمْ وَتُقْسِطُوٓا
اِلَيْهِمْ ۜ اِنَّ اللّٰهَ يُحِبُّ الْمُقْسِطِينَ ﴿٨﴾ اِنَّمَا يَنْهٰيكُمُ اللّٰهُ عَنِ الَّذِينَ قَاتَلُوكُمْ فِي الدِّينِ وَاَخْرَجُوكُمْ مِنْ
دِيَارِكُمْ وَظَاهَرُوا عَلٰى اِخْرَاجِكُمْ اَنْ تَوَلَّوْهُمْ ۚ وَمَنْ يَتَوَلَّهُمْ فَاُولٰٓئِكَ هُمُ الظَّالِمُونَ﴿٩﴾

---

*bağlayıb, mehriyyəsini də özündən verdi. Ümmü Həbibəni peyğəmbərə göndərdi. Elə ki, Əbu Süfyan peyğəmbərin onun qızı ilə evləndiyini eşitdi, dedi: "Bu, bir erkəkdir ki, onun burnu vurulmaz. Bu kəlam cins erkək dəvədən ötrü ərəblərdə məsəldir. Ondan sonra Əbu Süfyanın peyğəmbərə münasibəti mülayimləşib, ona bəslədiyi ədavət azaldı).*

**Allah-Təala məhəbbət yaratmağa qadirdir və müşriklərdən tövbə edənləri rəhm edib bağışlayandır. Elə ki, möminlər müşriklərlə ədavətlərində möhkəm oldular, Allah-Təala möminlərlə savaşmayan müşriklərə yaxşılıq edib, onlarla əlaqə qurmağa izin verdi. Necə ki, növbəti ayədə bəyan edir).**

**8) (لَا يَنْهٰيكُمُ اللّٰهُ عَنِ الَّذِينَ لَمْ يُقَاتِلُوكُمْ فِي الدِّينِ وَلَمْ يُخْرِجُوكُمْ مِنْ دِيَارِكُمْ اَنْ تَبَرُّوهُمْ وَتُقْسِطُوٓا اِلَيْهِمْ ۜ اِنَّ اللّٰهَ يُحِبُّ الْمُقْسِطِينَ) Ey möminlər, o müşriklər ki, sizinlə savaşmayıb və sizi Məkkədəki evlərinizdən çıxarmayıblar, Allah-Təala belə müşriklərə* yaxşılıq etməyi sizə qadağan etmir. Belə müşriklərlə ədalətlə rəftar edib, onlara zülm etməyin. Həqiqətən, Allah-Təala ədalətlə rəftar edənləri sevər.**

**(*Qeyd:** *"Əbu Bəkrin xanımı olan Qüteylə Əbdül-Üzza qızı Məkkədən töhfələrlə qızı Əsma Əbu Bəkir qızının yanına - Mədinəyə gəldi. Əsma anası müşrik olduğuna görə onun yanına gəlməsinə izin verməyib, töhfələrini qə qəbul etmədi. Buradakı ayədə Allah-Təala müşriklərlə ədalətlə rəftar etməyi möminlərə vəsiyyət edib, onlara zülm etməyi qadağan edirsə, gör, müsəlman şəxsə zülm etməyi nə şəkildə qadağan edir? Vay olsun, adlarını müsəlman qoyub, zülmü özlərinə şüar seçənlərin halına. Allah-Təalanın və uca peyğəmbərimizin hökmü ilə belə şəxslər islamdan kənardırlar).*

**9) (اِنَّمَا يَنْهٰيكُمُ اللّٰهُ عَنِ الَّذِينَ قَاتَلُوكُمْ فِي الدِّينِ وَاَخْرَجُوكُمْ مِنْ دِيَارِكُمْ وَظَاهَرُوا عَلٰى اِخْرَاجِكُمْ اَنْ تَوَلَّوْهُمْ) Həqiqətən, Allah-Təala sizə elə müşriklərlə dostluq etməyi qadağan edir ki, islama görə sizinlə savaşıb, yurdlarınızdan sizi çıxarıb və sizi qovmaqla öz ədavətlərini aşkar ediblər. Allah belə şəxslərlə dostluq etməyi sizə qadağan edir. (وَمَنْ يَتَوَلَّهُمْ فَاُولٰٓئِكَ هُمُ الظَّالِمُون) Siz möminlərdən kim ki, belə müşriklərlə dostluq etsə, əlbəttə belələri zalımdırlar.** *(Elə ki Allahın Rəsulu Hüdeybiyyədə Qüreyş camaatı ilə bu şəkildə sülh bağladı ki, kim ki, Qüreyşdən müsəlman olub Mədinəyə getsə, onu qaytarsın və kim ki, Mədinədən Məkkəyə gedib, mürtəd olsa, onu qaytarmasınlar. Kağız*

يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوٓا اِذَا جَٓاءَكُمُ الْمُؤْمِنَاتُ مُهَاجِرَاتٍ فَامْتَحِنُوهُنَّ اَللّٰهُ اَعْلَمُ بِاٖيمَانِهِنَّ فَاِنْ عَلِمْتُمُوهُنَّ مُؤْمِنَاتٍ فَلَا تَرْجِعُوهُنَّ اِلَى الْكُفَّارِ لَا هُنَّ حِلٌّ لَهُمْ وَلَا هُمْ يَحِلُّونَ لَهُنَّ وَاٰتُوهُمْ مَٓا اَنْفَقُوا وَلَا جُنَاحَ عَلَيْكُمْ اَنْ تَنْكِحُوهُنَّ اِذَٓا اٰتَيْتُمُوهُنَّ اُجُورَهُنَّ وَلَا تُمْسِكُوا بِعِصَمِ الْكَوَافِرِ

---

*yazılıb, hər iki tərəf möhürləyib, qurtarandan sonra Məkkədən Sübeyyə Haris Əsləmiyyənin qızı müsəlman olub, peyğəmbərin hüzuruna gəldi. Onun əri Müsafir ibn Əbi Əmr onun dalınca gəlib dedi: "Ey Məhəmməd, xanımımı mənə qaytar, bizimlə şərt bağlayıbsan ki, gələn şəxsi qaytarasan. Budur, hələ müqavilə kağızı qurumayıbdır. Allahın Rəsulu buyurdu: "O şərt kişilərə məxsusdur. Onun mehriyyəsini ərinə qaytarıb, tək yola saldı. Ömər ibn Xəttab onunla evləndi. O vaxt növbəti ayə nazil olub, iman edən qadınların imanının şərtini bəyan edir).*

**10) (يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوٓا اِذَا جَٓاءَكُمُ الْمُؤْمِنَاتُ مُهَاجِرَاتٍ فَامْتَحِنُوهُنَّ اَللّٰهُ اَعْلَمُ بِاٖيمَانِهِنَّ) Ey möminlər, o zaman ki, qadınlar hicrət edib, sizin tərəfinizə gəlib, iman etdiklərini bildirdilər, onlara* and içdirməklə, onların imanlarını imtahan edin. Ta ki, onların imanlarına agah olasınız. Bununla belə onların imanına Allah-Təala daha yaxşı agahdır.**

**(*Qeyd:** *"Allahın Rəsulu (ə.s) hicrət edən qadınlara and içdirib belə dedizdirirdi: "And olsun Allah-Təalaya ki, ərimə düşmən olub gəlmişəm; And olsun Allah-Təalaya ki, o vilayəti (Məkkəni) bəyənməyib, bu vilayəti (Mədinəni) bəyəndiyim üçün gəlməmişəm. And olsun Allah-Təalaya ki, dünya malı üçün gəlməmişəm. And olsun Allah-Təalaya ki, ancaq Allah və onun peyğəmbərinin məhəbbəti üçün öz yerimi qoyub gəlmişəm. Belə and içdirib, ondan sonra onların imanına etimad edərdi).*

**(فَاِنْ عَلِمْتُمُوهُنَّ مُؤْمِنَاتٍ فَلَا تَرْجِعُوهُنَّ اِلَى الْكُفَّارِ) - Mühacir qadınlara and içdirəndən sonra əgər onların mömin olmasına agah olsanız, o vaxt da o qadınları kafir ərlərinə, ya da başqa kafirlərə qaytarmayın.**

**(لَا هُنَّ حِلٌّ لَهُمْ وَلَا هُمْ يَحِلُّونَ لَهُنَّ وَاٰتُوهُمْ مَٓا اَنْفَقُوا) - Əgər o qadınların kafir ərləri olsa, nə o qadınlar ərlərinə halaldır, nə də ərləri o qadınlara halaldır. Ərlərinin verdiyi mehriyyəni özlərinə qaytarın.**

**(وَلَا جُنَاحَ عَلَيْكُمْ اَنْ تَنْكِحُوهُنَّ اِذَٓا اٰتَيْتُمُوهُنَّ اُجُورَهُنَّ) - Mehriyyələrini verdiyiniz zaman o qadınlarla nikahlanmağınızda sizə heç bir günah yoxdur.**

**(وَلَا تُمْسِكُوا بِعِصَمِ الْكَوَافِرِ) - Əgər sizin qadınlarınız "darül-hərb"də** (müsəlmanlarla savaş halında olan küfr yurdunda) **müşriklər arasında küfrlərində**

وَسْـَٔلُوا مَآ اَنْفَقْتُمْ وَلْيَسْـَٔلُوا مَآ اَنْفَقُواۜ ذٰلِكُمْ حُكْمُ اللّٰهِۜ يَحْكُمُ بَيْنَكُمْۜ وَاللّٰهُ عَلٖيمٌ حَكٖيمٌ ﴿١٠﴾ وَاِنْ
فَاتَكُمْ شَيْءٌ مِنْ اَزْوَاجِكُمْ اِلَى الْكُفَّارِ فَعَاقَبْتُمْ فَاٰتُوا الَّذٖينَ ذَهَبَتْ اَزْوَاجُهُمْ مِثْلَ مَآ اَنْفَقُواۜ وَاتَّقُوا اللّٰهَ
الَّذٖٓي اَنْتُمْ بِهٖ مُؤْمِنُونَ﴿١١﴾ يَآ اَيُّهَا النَّبِيُّ اِذَا جَآءَكَ الْمُؤْمِنَاتُ يُبَايِعْنَكَ عَلٰٓى اَنْ لَا يُشْرِكْنَ بِاللّٰهِ شَيْـًٔا

---

**qalsalar, ya da mürtəd olub kafirlərə qoşulsalar, elə kafir qadınlarla evliliyi davam etdirməyin. Sizinlə onların arasındakı nikah ləğv olundu. (وَسْـَٔلُوا مَآ اَنْفَقْتُمْ وَلْيَسْـَٔلُوا مَآ اَنْفَقُواۜ) - Əgər sizin qadınlarınızdan mürtəd olub, müşriklərə qoşulan olsa, onlarla evlənən şəxslərdən o qadınlara verdiyiniz mehriyyələri geri istəyin. Kafirlər də sizin tərəfinizə gələn müsəlman qadınlara verdikləri mehriyyələri sizdən geri istəsinlər.**

**(ذٰلِكُمْ حُكْمُ اللّٰهِۜ يَحْكُمُ بَيْنَكُمْۜ وَاللّٰهُ عَلٖيمٌ حَكٖيمٌ) - Bu hökm qadınlar barəsində Allah-Təalanın hökmüdür ki, sizin aranızda hökm edir. Allah-Təala hər bir şeyə agah və hikmət sahibidir.** (İman edib, hicrət edən qadınların mehriyyələrini möminlər müşriklərə verdilər, lakin mürtəd olub gedən qadınların mehriyyələrini müşriklər vermədilər. Bu barədə növbəti ayə nazil oldu).

**11) (وَاِنْ فَاتَكُمْ شَيْءٌ مِنْ اَزْوَاجِكُمْ اِلَى الْكُفَّارِ فَعَاقَبْتُمْ) - Əgər bundan sonra möminlərin xanımlarından bir kəs sizdən gedib, mürtəd olub müşriklərə* qoşulsa, o vaxt da sizin mehriyyə vermək növbəniz yetişibdir. İndi ki, müşriklər vermirlər, gərək onların mehriyyələrini siz verəsiniz.**

**(فَاٰتُوا الَّذٖينَ ذَهَبَتْ اَزْوَاجُهُمْ مِثْلَ مَآ اَنْفَقُواۜ) Xanımları mürtəd olub kafirlərin tərəfinə gedən möminlərə xanımlarına verdikləri mehriyyənin miqdarı qədər malı siz möminlər öz aranızda toplayıb onlara verin.**

**(وَاتَّقُوا اللّٰهَ الَّذٖٓي اَنْتُمْ بِهٖ مُؤْمِنُونَ) - O Allah-Təala ki, siz möminlər ona iman edibsiniz, ondan qorxub bu hökmə əməl edin.** (Elə ki, Allahın Rəsulu Məkkəni fəth edib, kişilər də ona beyət edib qurtardılar, növbə qadınlara çatdı, qadınların beyəti xüsusunda növbəti ayə nazil oldu).

**(*Qeyd:** "Hicrət edən möminlərin xanımlarından müşriklərə qoşulanlar altı nəfərdir. 1) Ümmül-Hakəm Əbu Süfyan qızı, İyaz ibn Şəddadın xanımı idi. 2) Fatimə Əbu Ümeyyə qızı, peyğəmbərin xanımı Ümmü Sələmənin bacısı və Ömər ibn Xəttabın xanımı idi. 3) (Yüru (Büru) Uqbə ibn Əbu Muitin qızı, Şəmmas ibn Osmanın xanımı idi, 4) Abidə Əbdül-Üzzə qızı, 5) Hind Əbu Cəhl qızı, Hişam ibn əl-Asın xanımı idi. 6) Ümmü Külsüm Cərvəl qızı, Ömər ibn Xəttabın ikinci xanımı. Bu altı qadın ərləri müsəlman olandan sonra qayıdıb müşriklərə qoşuldular. Allahın Rəsulu onların mehriyyəsinin əvəzini müsəlman ərlərinə verdi).

**12) (يَآ اَيُّهَا النَّبِيُّ اِذَا جَآءَكَ الْمُؤْمِنَاتُ يُبَايِعْنَكَ عَلٰٓى اَنْ لَا يُشْرِكْنَ بِاللّٰهِ شَيْـًٔا) Ey peyğəmbər,** (Allah-Təala peyğəmbərə belə xitab edib, adıyla xitab etmir ki, müsəlmanlar

da ədəbə riayət edib, o cənaba adıyla xitab etməsinlər). **O zaman ki, iman edən qadınlar beyət etməkdən ötrü sənin hüzuruna gəldilər, gərək bu şərtlərlə beyət* etsinlər. Birinci şərt - gərək Allah-Təalaya heç bir şeyi şərik qoşmasınlar.**

**(*Qeyd:** *"Allahın Rəsulu Məkkəni fəth edəndən sonra qadınlardan beyət alanda Səfada əyləşib Ömər ibn Xəttab ondan aşağı dayanıb peyğəmbərin əmri ilə onlardan beyət alırdı. Əbu Süfyanın xanımı olan Hind Utbə qızı, peyğəmbər onu tanımasın deyə üzünü bağlamış və qadınların arasına daxil olmuşdu. Elə ki, beyət başladı, Allahın Rəsulu beyətin şərtlərini onlara bəyan etmək üçün buyurdu: "Sizdən beyət alıram, bu şərtlə ki, heç bir şeyi Allah-Təalaya şərik qoşmayasınız. Qadınların arasından Hind başını qaldırıb dedi: "And olsun Allah-Təalaya ki, doğrudur, biz bütlərə sitayiş etmişik, lakin sən bizdən o şeyi qəbul edirsən ki, kişilərdən bunu qəbul etməyib, onlardan ancaq islam və cihad üçün beyət aldın. Peyğəmbər buyurdu: "Gərək oğurluq etməsinlər. Hind başını qaldırıb dedi: "Əbu Süfyan xəsis bir kişidir, mən onun malından götürüb sərf etmişəm, indi bilmirəm, mənə halaldır, yoxsa yox. Əbu Süfyan cavab verib dedi: "Hər bir şeyi ki, keçmişdə alıbsan və nə qədər ki, bundan sonra alacaqsan, sənə halaldır. Peyğəmbər o zaman Hindi tanıyıb, təbəssüm edib dedi: "Sən Hind Utbə qızısanmı? Dedi: "Bəli, ey peyğəmbər, keçmişi əfv et. Dedi: "Allah-Təala da səni bağışlasın. Peyğəmbər buyurdu: "Gərək zina etməsinlər. Hind dedi: "Bəs azad qadın zina edərmi? Peyğəmbər buyurdu: "Gərək qadınlar övladlarını qətl etməsinlər. Hind söylədi: "Biz uşaqlara kiçik olarkən tərbiyə verdik. Böyük olduqda siz onları qətl etdiniz. (Bu kəlamla Hənzələ adlı oğlunun Bədir savaşında müsəlmanlar tərəfindən öldürülməsinə işarə etdi). Bu sözdən Ömər ibn Xəttabı gülmək tutdu. O qədər güldü ki, arxası üstə yıxıldı. Peyğəmbər təbəssüm etdi. (Ömər ibn Xəttabın gülməyini Zəməxşəri və ondan başqa bəzi təfsirçilər də bu məqamda qeyd ediblər. Lakin Hindin oğlunun öldürülməsi xəbərini verməsinin gülməli bir kəlam sayılması təəccüblüdür. Başqa rəvayətlərə və normal məntiqə görə Ömər ibn Xəttabın burada gülməsi qadınlara zinanın qadağan edilməsi anında olubdur. Cahiliyyə zamanında Hind zinakarlığı ilə məşhur bir qadın idi, yoldaşlarından bəziləri də Abbas ibn Əbdülmüttəlib və Ömər ibn Xəttab idi. Elə ki, Hind zina qadağasına təəccüb edib dedi: "Bəs azad qadın da zina edərmi? Bu kəlamdan Ömərі gülmək tutdu. Yəni məndən xəcalət çəkməyib, zina məsələsinə təəccüb edir. Bəli, belə məqamda şəxsi gülmək tuta bilər, nəinki bir kəsin qətl edilməsi xəbərində. Guya zinanın qəbahətini Ömərdən dəf etmək üçün onun gülməyini qətl xəbərinə aid ediblər. Lakin cahiliyyə zamanında vaqe olan işlərin qəbahətini Ömərdən, ya da başqasından dəf etməkdən ötrü tarixi dəyişdirmək yanlış bir əməldir. Səhabələrin əksəriyyəti islamdan əvvəl nəinki zina, hətta şərab, qumara da qurşanmışdılar,*

وَلَا يَسْرِقْنَ وَلَا يَزْنِينَ وَلَا يَقْتُلْنَ اَوْلَادَهُنَّ وَلَا يَأْتِينَ بِبُهْتَانٍ يَفْتَرِينَهُ بَيْنَ اَيْدِيهِنَّ وَاَرْجُلِهِنَّ وَلَا يَعْصِينَكَ فِي مَعْرُوفٍ فَبَايِعْهُنَّ وَاسْتَغْفِرْ لَهُنَّ اللّٰهَ ۚ اِنَّ اللّٰهَ غَفُورٌ رَحِيمٌ ﴿١٢﴾ يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا لَا تَتَوَلَّوْا قَوْمًا غَضِبَ اللّٰهُ عَلَيْهِمْ قَدْ يَئِسُوا مِنَ الْاٰخِرَةِ كَمَا يَئِسَ الْكُفَّارُ مِنْ اَصْحَابِ الْقُبُورِ ﴿١٣﴾

---

*amma onlardan ötrü bu, bir eyib sayıla bilməz. Gərək onların islamdan sonrakı əməllərinə baxaq, şərab Mədinədə, hicrətdən sonra haram edilibdir. O vaxta kimi müsəlmanlar içirdilər, bundan onlara bir qüsur gələrmi? Kim ki, bir şeyin haramlığına hökm veriləndən sonra ona qurşanarsa, o şəxs üçün qüsur varid olar). Qayıdaq beyət əhvalatına. Peyğəmbər buyurdu: "Gərək qadınlar özgədən zina ilə hamilə qalıb, doğduqları uşağı yalandan ərlərinə isnad etməsinlər. Hind dedi: "Bu, çirkin bir işdir, ey peyğəmbər, sən bizə doğruluğu və gözəl əxlaqı əmr edirsən. Peyğəmbər buyurdu: "Gərək heç bir işdə mənə asi olmasınlar. Hind dedi: "Əgər bizdə sənə qarşı bir asilik varsa, belə məqamda durmaq bizə layiq deyildir. Allahın Rəsulu bir qədəh su istəyib, bərəkətli əlini o suya daxil edib, verdi qadınlara, onlar da əllərini o suya daxil edib, bu şəkildə beyət edib qurtardılar).*

**(وَلَا يَسْرِقْنَ) - İkinci şərt - gərək oğurluq etməsinlər. (وَلَا يَزْنِينَ) - Üçüncü şərt - gərək zina etməsinlər. (وَلَا يَقْتُلْنَ اَوْلَادَهُنَّ) - Dördüncü şərt - gərək övladlarını qətl etməsinlər, yəni ərəblərdə çirkin bir adət var idi, ərəblərin böyükləri qız övladları olanda onu diri-diri torpağa basdırardılar. Bu mətləbin təfsilatı kitabın I cildində qeyd olunubdur.**

**(وَلَا يَأْتِينَ بِبُهْتَانٍ يَفْتَرِينَهُ بَيْنَ اَيْدِيهِنَّ وَاَرْجُلِهِنَّ) - Beşinci şərt - gərək qadınlar hamilə olub doğduqları haqda ərlərinə yalan deməsinlər.** (Yəni özgədən hamilə olub doğduqları övladı ərlərinə yalandan isnad edib, deməsinlər ki, bu övlad səndəndir). **(وَلَا يَعْصِينَكَ فِي مَعْرُوفٍ) Altıncı şərt -** (Ey Məhəmməd), **əmr etdiyin gözəl şeylərdə gərək sənə asi olmasınlar. Əksinə hər bir işdə sənə itaət etmələri lazımdır. (فَبَايِعْهُنَّ وَاسْتَغْفِرْ لَهُنَّ اللّٰهَ ۚ اِنَّ اللّٰهَ غَفُورٌ رَحِيمٌ)** - (Ey Məhəmməd), **əgər bu şərtlər ilə sənə beyət etsələr, sən də onlardan o şərtlərlə beyət alıb, Allah-Təaladan onların əfv edilməsini istə. Həqiqətən, Allah-Təala iman edənlərə rəhm edib, onları bağışlayandır.**

**13) (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا لَا تَتَوَلَّوْا قَوْمًا غَضِبَ اللّٰهُ عَلَيْهِمْ) Ey iman edənlər, bir camaat ki,** (yəhudilər) **Allah-Təala onlara qəzəb edibdir, onlarla dostluq etməyin, Allah-Təalanın qəzəbləndiyi şəxslərlə dostluq etmək layiq deyildir. (قَدْ يَئِسُوا مِنَ الْاٰخِرَةِ كَمَا يَئِسَ الْكُفَّارُ مِنْ اَصْحَابِ الْقُبُورِ) Yəhudilər peyğəmbərin haqq olmasına agah olub, ona olan ədavətləri səbəbi ilə inkar etdikləri üçün axirət savabından ümidlərini üzüblər. Necə ki, qəbirdə olan kafirlər axirət savabından ümidlərini üzüblər.**

**Allaha həmd olsun, əl-Mümtəhinə surəsinin təfsiri tamamlandı, Allahın Rəsulu buyurdu: "Kim əl-Mümtəhinə surəsini oxusa, möminlər ondan ötrü qiyamət günündə "şəfaət" (əfv edilməsini) istəyərlər.**

## əs-SAF SURƏSİ

61-cu surədir. Mədinədə nazil olub, 14 ayə, 221 kəlmə və 900 hərfdir.

سَبَّحَ لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۚ وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ ﴿١﴾ يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا لِمَ تَقُولُونَ مَا لَا تَفْعَلُونَ ﴿٢﴾ كَبُرَ مَقْتًا عِنْدَ اللّٰهِ اَنْ تَقُولُوا مَا لَا تَفْعَلُونَ ﴿٣﴾ اِنَّ اللّٰهَ يُحِبُّ الَّذِينَ يُقَاتِلُونَ فِي سَبِيلِهِ صَفًّا كَاَنَّهُمْ بُنْيَانٌ مَرْصُوصٌ ﴿٤﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

(Möminlərə cihad əmr edilmədən əvvəl bir-birləri ilə danışıb deyirdilər: "Kaş ki, biz biləydik ki, hansı əməl Allah-Təalanın yanında daha yaxşıdır, ona da əməl edərdik. Bu sözdən sonra cihadla əmr olundular. Elə ki, Uhud savaşı oldu, qaçıb dağıldılar, bu mübarək surə nazil olub, dedikləri sözlərinə görə məzəmmət edildilər. Lakin ayə hər bir yalan və vədə xilaf çıxmaq haqqındadır).

**1) (سَبَّحَ لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۚ وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ)** - (Ey Məhəmməd), **göylərdə və yerdə olan hər bir şey,** (varlıqları ilə) **Allah-Təalanı zikr edib, hər bir eyib və nöqsandan onu müqəddəs sayırlar. Məxluqata qalib olan və hər bir işində hikmət sahibi olan Allah-Təaladır.**

**2) (يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا لِمَ تَقُولُونَ مَا لَا تَفْعَلُونَ) Ey möminlər, siz ki, iman etdiyinizi iddia edirsiniz, niyə əməl etmədiyiniz sözləri deyirsiniz? Adam gərək dediyi sözə əməl etsin.**

**3) (كَبُرَ مَقْتًا عِنْدَ اللّٰهِ اَنْ تَقُولُوا مَا لَا تَفْعَلُونَ) Allah-Təalanın yanında böyük düşmənçilik odur ki, etmədiyiniz şeyi deyirsiniz, Allah-Təalanın bundan böyük qəzəbləndiyi şey yoxdur.**

**4) (اِنَّ اللّٰهَ يُحِبُّ الَّذِينَ يُقَاتِلُونَ فِي سَبِيلِهِ صَفًّا كَاَنَّهُمْ بُنْيَانٌ مَرْصُوصٌ) Həqiqətən, Allah-Təala o şəxsləri sevər ki, öz yolunda sanki* möhkəm bina kimi səf çəkib durub, cihad edir, deyirdiniz ki, biz, Allah-Təalanın sevdiyi şeyi edərik, bəs niyə cihad etməkdə möhkəm olmayıb,** (Uhud) **savaşında qaçdınız? Etməyəcəyiniz şeyi deməyin.**

**(*Qeyd:** *"Allah-Təala cihad işində sözləri və niyyətləri bir olan, möhkəm ittifaq edən müsəlmanları möhkəm bir binaya oxşadır ki, onun dağılması heç cür mümkün olmaz və müsəlmanlar da hər bir işlərində gərək həmin möhkəm bina kimi olsunlar. Birlik və ittifaq islamın əsl binasıdır. İxtilaf və təfriqə nifaq əlamətidir və bu səbəbdən islam ümmətində ixtilaf zühur edib, nifaq və xəbislik yerləşəndən bəri müsəlmanlar zəifliyə düçar olublar. Bir zamanlar hakim olandan*

وَاِذْ قَالَ مُوسٰى لِقَوْمِهٖ يَا قَوْمِ لِمَ تُؤْذُونَنِي وَقَدْ تَعْلَمُونَ اَنِّي رَسُولُ اللّٰهِ اِلَيْكُمْ ۖ فَلَمَّا زَاغُوٓا اَزَاغَ اللّٰهُ قُلُوبَهُمْ ۖ وَاللّٰهُ لَا يَهْدِي الْقَوْمَ الْفَاسِقِينَ ﴿٥﴾ وَاِذْ قَالَ عِيسَى ابْنُ مَرْيَمَ يَا بَنِيٓ اِسْرَآءِيلَ اِنِّي رَسُولُ اللّٰهِ اِلَيْكُمْ مُصَدِّقًا لِمَا بَيْنَ يَدَيَّ مِنَ التَّوْرٰيةِ وَمُبَشِّرًا بِرَسُولٍ يَاْتِي مِنْ بَعْدِي اسْمُهُ اَحْمَدُ ۖ فَلَمَّا جَآءَهُمْ بِالْبَيِّنَاتِ قَالُوا هٰذَا سِحْرٌ مُبِينٌ ﴿٦﴾ وَمَنْ اَظْلَمُ مِمَّنِ افْتَرٰى عَلَى اللّٰهِ الْكَذِبَ وَهُوَ يُدْعٰٓى اِلَى الْاِسْلَامِ

---

*sonra indi digər millətlərin yanında zəlil, həqir, vəhşi bir heyvan kimi görünürlər, halbuki islamın əsl binası mədəniyyət və gözəl əxlaq əsasında qoyulubdur. Bunların hamısı Qurani-Şərifdən kənar olub, onun uca məzmununu dərk etməməkdən qaynaqlanan məsələlərdir. Bir halda ki, əziz kitabımız Qurani-Şərifin ehkamı rəvac tapmayıb, şəxsi rəylər yox edilməsə, islam ümmətinin nicat tapıb, maarifin həqiqi zirvəsinə qalxması mümkün deyildir).*

**5) (وَاِذْ قَالَ مُوسٰى لِقَوْمِهٖ يَا قَوْمِ لِمَ تُؤْذُونَنِي وَقَدْ تَعْلَمُونَ اَنِّي رَسُولُ اللّٰهِ اِلَيْكُمْ)** (Ey Məhəmməd), **qövmü Musaya nə qədər əziyyət etsə də, o, səbir etdi, sən də ona baxıb səbir et, yadına sal, o zaman ki, Musa öz qövmü olan Bəni-İsrailə dedi: "Ey mənim qövmüm, mənə niyə əziyyət edirsiniz, halbuki dəqiq bilirsiniz ki, mən Allah-Təalanın peyğəmbəriyəm, sizə göndərilmişəm ki, Allah-Təalanın ehkamını sizə çatdırım. Mənim haqlı olduğumu bildiyiniz halda, gərək mənə itaət edib, tazim və hörmət edəsiniz. Nəinki mənə əziyyət edib, istehza edəsiniz. (فَلَمَّا زَاغُوٓا اَزَاغَ اللّٰهُ قُلُوبَهُمْ) Elə ki, Musaya itaət etməyib, Haqqdan uzaqlaşdılar, Allah-Təala da lütf və rəhmətini onlardan əsirgəyib, küfr və zəlalətdə qaldılar. (وَاللّٰهُ لَا يَهْدِي الْقَوْمَ الْفَاسِقِينَ) Allah-Təala fasiq camaata** (hidayətə qabil olmadıqlarına görə) **hidayət etməyib, lütf və rəhmətini onlara şamil etməz.**

**6) (وَاِذْ قَالَ عِيسَى ابْنُ مَرْيَمَ يَا بَنِيٓ اِسْرَآءِيلَ اِنِّي رَسُولُ اللّٰهِ اِلَيْكُمْ مُصَدِّقًا لِمَا بَيْنَ يَدَيَّ مِنَ التَّوْرٰيةِ وَمُبَشِّرًا بِرَسُولٍ يَاْتِي مِنْ بَعْدِي اسْمُهُ اَحْمَدُ)** (Ey Məhəmməd), **İsa Məryəm oğlunu yadına salıb, ona baxıb səbir elə, o zaman ki, o, Bəni-İsrailə xitab edib dedi: "Ey** (Bəni İsrail), **həqiqətən, məndən əvvəl nazil olan Tövratı təsdiq edib və məndən sonra gələn Əhməd adlı peyğəmbəri müjdələdiyim halda sizə peyğəmbər gəlmişəm. Mənim dinim Allah-Təalanın keçmiş və bundan sonra gələcək peyğəmbərlərini və kitablarını təsdiq etməkdir və özümün də haqq olmağı haqda Allah-Təala mənə dəlil və sübut veribdir.**

**(فَلَمَّا جَآءَهُمْ بِالْبَيِّنَاتِ قَالُوا هٰذَا سِحْرٌ مُبِينٌ) Elə ki (İsa) özünün doğruluğuna işarə edən dəlil və sübutlarla Bəni-İsrailə gəldi, onu qəbul etməyib, bunlar açıq-aşkar sehrdir, dedilər.**

**7) (وَمَنْ اَظْلَمُ مِمَّنِ افْتَرٰى عَلَى اللّٰهِ الْكَذِبَ وَهُوَ يُدْعٰٓى اِلَى الْاِسْلَامِ) - O şəxsləri ki, Allah-Təala peyğəmbərlərinin möcüzəli bəyanı vasitəsi ilə islama (haqqa)**

وَاللّٰهُ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ ﴿٧﴾ يُرِيدُونَ لِيُطْفِؤُا نُورَ اللّٰهِ بِاَفْوَاهِهِمْ وَاللّٰهُ مُتِمُّ نُورِهٖ وَلَوْ كَرِهَ الْكَافِرُونَ
﴿٨﴾ هُوَ الَّذِيٓ اَرْسَلَ رَسُولَهُ بِالْهُدٰى وَدِينِ الْحَقِّ لِيُظْهِرَهُ عَلَى الدِّينِ كُلِّهٖ وَلَوْ كَرِهَ الْمُشْرِكُونَ ﴿٩﴾ يَٓا
اَيُّهَا الَّذِينَ اٰمَنُوا هَلْ اَدُلُّكُمْ عَلٰى تِجَارَةٍ تُنْجِيكُمْ مِنْ عَذَابٍ اَلِيمٍ ﴿١٠﴾ تُؤْمِنُونَ بِاللّٰهِ وَرَسُولِهٖ وَتُجَاهِدُونَ
فٖي سَبِيلِ اللّٰهِ بِاَمْوَالِكُمْ وَاَنْفُسِكُمْ ذٰلِكُمْ خَيْرٌ لَكُمْ اِنْ كُنْتُمْ تَعْلَمُونَ ﴿١١﴾ يَغْفِرْ لَكُمْ ذُنُوبَكُمْ وَيُدْخِلْكُمْ
جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ وَمَسَاكِنَ طَيِّبَةً فٖي جَنَّاتِ عَدْنٍ ذٰلِكَ الْفَوْزُ الْعَظٖيمُ ﴿١٢﴾

---

**dəvət edir, onlar da qəbul etməyib Allah-Təalanın sözünə sehr deyirlər, belə şəxslərdən daha zalım olan kimdir? Bunlardan daha zalım şəxs varmı? (وَاللّٰهُ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ) Allah-Təala zalım camaatı haqqa hidayət etdirməyib, lütf və mərhəmətini onlara şamil etməz.**

**8) (يُرِيدُونَ لِيُطْفِؤُا نُورَ اللّٰهِ بِاَفْوَاهِهِمْ وَاللّٰهُ مُتِمُّ نُورِهٖ وَلَوْ كَرِهَ الْكَافِرُونَ)** - (Ey Məhəmməd), **kafir və müşriklərin istəyi odur ki, Allah-Təalanın nurunu** (çırağı söndürən kimi) **ağızlarıyla söndürüb, Qurana sehr deyib, islam dinini batil etsinlər. Hərçənd onlar xoşlanmayacaqlar, lakin Allah-Təala öz nurunu tamamlayıb, islam dinini yayacaqdır.** (Necə ki, yaydı).

**9) (هُوَ الَّذِيٓ اَرْسَلَ رَسُولَهُ بِالْهُدٰى وَدِينِ الْحَقِّ لِيُظْهِرَهُ عَلَى الدِّينِ كُلِّهٖ وَلَوْ كَرِهَ الْمُشْرِكُونَ) Allah-Təala peyğəmbəri** (Məhəmmədi) **hidayət və haqq dini** (islamla) **göndərdi ki, əgər müşriklər onun dediklərindən xoşlanmasalar da, onu qalib edib, müşrikləri zəlil və məğlub etsin.** (Həqiqətən, Allah-Təala vədinə vəfa etdi, islam dini yer kürəsində yayılıb, hər bir dinə qalib və uca oldu. Lakin bu zamanda islam ümmətinin öz içindəki nifaq və ixtilaf müsəlmanların zəifləyib, geri getməsinə bais olubdur. Allah-Təala da onların öz əməllərinin və nifaqlarının səbəbinə lütf və rəhmətini onlardan kəsibdir).

**10) (يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا هَلْ اَدُلُّكُمْ عَلٰى تِجَارَةٍ تُنْجِيكُمْ مِنْ عَذَابٍ اَلِيمٍ) Ey möminlər, istəyirsiniz axirətin əziyyətli əzabından nicat verən bir ticarətin yolunu sizə göstərim?**

**11) (تُؤْمِنُونَ بِاللّٰهِ وَرَسُولِهٖ وَتُجَاهِدُونَ فٖي سَبِيلِ اللّٰهِ بِاَمْوَالِكُمْ وَاَنْفُسِكُمْ) - O ticarət budur ki, Allah-Təalaya və onun peyğəmbərinə** (Məhəmmədə) **iman edib, Allah-Təalanın yolunda mal və nəfsinizlə cihad edəsiniz. Sizə axirət əzabından nicat verən bu əməllərdir. (ذٰلِكُمْ خَيْرٌ لَكُمْ اِنْ كُنْتُمْ تَعْلَمُونَ) - Bu əməllərin sizdən ötrü xeyir olmasına əgər agah olsanız, bu əməllər sizdən ötrü xeyir və yaxşı əməllərdir. Gərək onlara yönəlib, əldə edəsiniz.**

**12) (يَغْفِرْ لَكُمْ ذُنُوبَكُمْ وَيُدْخِلْكُمْ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ) O vaxt da Allah-Təala sizin günahlarınızı bağışlayıb, sizləri ağaclarının və qəsrlərinin altından çaylar axan cənnətlərə daxil edər.**

**(وَمَسَاكِنَ طَيِّبَةً فٖي جَنَّاتِ عَدْنٍ ذٰلِكَ الْفَوْزُ الْعَظٖيمُ) - Əbədi cənnətlərdəki pakizə mənzillərə sizləri daxil edər, böyük əcr və savaba yetişmək budur.**

وَاُخْرٰى تُحِبُّونَهَاۜ نَصْرٌ مِنَ اللّٰهِ وَفَتْحٌ قَر۪يبٌۜ وَبَشِّرِ الْمُؤْمِن۪ينَ ﴿١٣﴾ يَٓا اَيُّهَا الَّذ۪ينَ اٰمَنُوا كُونُوٓا اَنْصَارَ اللّٰهِ كَمَا قَالَ ع۪يسَى ابْنُ مَرْيَمَ لِلْحَوَارِيّ۪نَ مَنْ اَنْصَار۪يٓ اِلَى اللّٰهِۜ قَالَ الْحَوَارِيُّونَ نَحْنُ اَنْصَارُ اللّٰهِ فَاٰمَنَتْ طَٓائِفَةٌ مِنْ بَن۪ٓي اِسْرَٓاء۪يلَ وَكَفَرَتْ طَٓائِفَةٌۚ فَاَيَّدْنَا الَّذ۪ينَ اٰمَنُوا عَلٰى عَدُوِّهِمْ فَاَصْبَحُوا ظَاهِر۪ينَ ﴿١٤﴾

---

**13) (وَاُخْرٰى تُحِبُّونَهَاۜ نَصْرٌ مِنَ اللّٰهِ وَفَتْحٌ قَر۪يبٌۜ) Siz möminlərdən ötrü axirət nemətindən başqa dünyada bir nemət də vardır ki, onu istəyirsiniz. O nemət** (Məkkəni fəth etməkdir). **Allah-Təaladan sizə yardım gəlib, yaxın zamanda** (Məkkəni) **fəth edib, ora daxil olarsınız. (وَبَشِّرِ الْمُؤْمِن۪ينَ)** - (Ey Məhəmməd), **möminləri Məkkənin fəthi ilə müjdələ.**

**14) (يَٓا اَيُّهَا الَّذ۪ينَ اٰمَنُوا كُونُوٓا اَنْصَارَ اللّٰهِ كَمَا قَالَ ع۪يسَى ابْنُ مَرْيَمَ لِلْحَوَارِيّ۪نَ مَنْ اَنْصَار۪يٓ اِلَى اللّٰهِ) Ey iman edənlər, Allah-Təalanın dininə kömək olub, islam dininin ucalması üçün səy edin. Necə ki, həvarilər İsaya kömək edib, dini ucaltmaq üçün səy etdilər. O vaxt ki,** (cənab) **İsa onlara dedi: "Mənə tabe olub, Allah-Təalanın dininə kömək verməyə çalışan kimdir?**

**(قَالَ الْحَوَارِيُّونَ نَحْنُ اَنْصَارُ اللّٰهِ) Həvarilər** (İsaya iman edən ilk 12 nəfər) **dedilər: "Allah-Təalanın dininə kömək edib, rəvac verən bizik.** (Həqiqətən, cənab İsanın dininə rəvac verib, yayan bu 12 nəfər həvari oldu).

**(فَاٰمَنَتْ طَٓائِفَةٌ مِنْ بَن۪ٓي اِسْرَٓاء۪يلَ وَكَفَرَتْ طَٓائِفَةٌۚ) - Bəni-İsraildən bir qrup İsaya iman edib, digər qruplar kafir oldular. (فَاَيَّدْنَا الَّذ۪ينَ اٰمَنُوا عَلٰى عَدُوِّهِمْ فَاَصْبَحُوا ظَاهِر۪ينَ) (İsanın) möminlərinə düşmənlərinə** (kafirlərə) **qarşı qüvvətləndirdik, onlara qalib olub, haqq dini yaydılar.** (Ey Məhəmməd), **habelə sənə iman edənləri də kafirlərə, iman etməyənlərə qarşı qüvvətləndirib, onlara qalib edəcəyəm. Allah-Təala vədinə vəfa etdi, islama daxil olanlar peyğəmbərdən sonra da qeyrət və namuslarını mühafizə edib birlik və ittifaq sayəsində yer kürəsinin əksər hissəsinə malik oldular. İndi müsəlmanların öz keçmiş günlərinə baxıb, bu günkü günlərinə ağlamaları lazımdır.**

**Allaha həmd olsun, Saf surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: "Kim Saf surəsini oxusa, İsa** (ə.s) **ondan ötrü Allahdan əfv istəyər və qiyamət günündə ona yoldaş olar.**

## əl-CÜMƏ SURƏSİ

62-ci surədir. Məkkədə nazil olub, 11 ayə, 180 kəlmə və 720 hərfdir.

يُسَبِّحُ لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ الْمَلِكِ الْقُدُّوسِ الْعَزِيزِ الْحَكِيمِ ﴿١﴾ هُوَ الَّذِي بَعَثَ
فِي الْاُمِّيِّنَ رَسُولًا مِنْهُمْ يَتْلُوا عَلَيْهِمْ اٰيَاتِهِ وَيُزَكِّيهِمْ وَيُعَلِّمُهُمُ الْكِتَابَ وَالْحِكْمَةَ وَاِنْ كَانُوا مِنْ
قَبْلُ لَفِي ضَلَالٍ مُبِينٍ ﴿٢﴾ وَاٰخَرِينَ مِنْهُمْ لَمَّا يَلْحَقُوا بِهِمْ وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ ﴿٣﴾ ذٰلِكَ فَضْلُ
اللّٰهِ يُؤْتِيهِ مَنْ يَشَاءُ وَاللّٰهُ ذُو الْفَضْلِ الْعَظِيمِ ﴿٤﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (يُسَبِّحُ لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ) Göylərdə və yerdə hər bir şey** (öz varlıqları ilə) **Allah-Təalanı zikr edib, hər bir eyib və nöqsandan onu müqəddəs sayırlar. (الْمَلِكِ الْقُدُّوسِ الْعَزِيزِ الْحَكِيمِ) Allah-Təala məxluqata qalib olub, onların işlərini hikmət üzrə təqdir edib, hər bir eyib və nöqsandan pak və müqəddəs və külli varlığa sahibdir.**

**2-3) (هُوَ الَّذِي بَعَثَ فِي الْاُمِّيِّنَ رَسُولًا مِنْهُمْ يَتْلُوا عَلَيْهِمْ اٰيَاتِهِ وَيُزَكِّيهِمْ)** (Allah-Təala) **öz kamil qüdrəti ilə ümmilərdən bir ümmini** (oxuyub, yazmayan bir şəxsi - Məhəmmədi) **seçib, ona elm və kitab öyrədib, peyğəmbər göndərdi ki, Allah-Təalanın ayələrini insanlara oxuyub, küfr və şirkdən və hər bir xəbis əməldən onları pak və uca etsin.**

**(وَيُعَلِّمُهُمُ الْكِتَابَ وَالْحِكْمَةَ وَاِنْ كَانُوا مِنْ قَبْلُ لَفِي ضَلَالٍ مُبِينٍ) Həmin peyğəmbəri** (Məhəmmədi) **insanlara peyğəmbər göndərdi, ta ki, Quranı və öz mübarək ağlı ilə vəz etdiyi qanun və ehkamları insanlara öyrədib, onları vəhşilikdən və cəhalətdən qurtarsın, həqiqətən, ondan əvvəl insanlar açıq-aşkar zəlalətdə idilər. (وَاٰخَرِينَ مِنْهُمْ لَمَّا يَلْحَقُوا بِهِمْ) Allah-Təala ümmi olan** (Məkkə) **əhlindən onu** (Məhəmmədi) **o zamanın insanlarına peyğəmbər göndərdi. Bir də o şəxslərə onu peyğəmbər göndərdi ki, onlar hələ dünyaya gəlməyiblər və ondan sonra dünyaya gələcəklər. Hamısına Məhəmmədi** (ə.s) **peyğəmbər göndərdi. (وَهُوَ الْعَزِيزُ الْحَكِيمُ) Allah-Təala məxluqata qalibdir. Öz hikməti üzrə insanların arasından ümmi bir şəxsi seçib, peyğəmbərlik kimi böyük bir mənsəb sahibi edib, onu qüvvətləndirdi.**

**4) (ذٰلِكَ فَضْلُ اللّٰهِ يُؤْتِيهِ مَنْ يَشَاءُ وَاللّٰهُ ذُو الْفَضْلِ الْعَظِيمِ) - Bu böyük dərəcə ki, Allah-Təala** (Məhəmmədə) **bəxş edibdir,** (öz zamanında mövcud olan və ondan sonra qiyamətə kimi dünyaya gələcək olan insanlara onu peyğəmbər etmək)

مَثَلُ الَّذٖينَ حُمِّلُوا التَّوْرٰيةَ ثُمَّ لَمْ يَحْمِلُوهَا كَمَثَلِ الْحِمَارِ يَحْمِلُ اَسْفَارًاۜ بِئْسَ مَثَلُ الْقَوْمِ الَّذٖينَ كَذَّبُوا بِاٰيَاتِ اللّٰهِۜ وَاللّٰهُ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمٖينَ ﴿٥﴾ قُلْ يَٓا اَيُّهَا الَّذٖينَ هَادُوٓا اِنْ زَعَمْتُمْ اَنَّكُمْ اَوْلِيَٓاءُ لِلّٰهِ مِنْ دُونِ النَّاسِ فَتَمَنَّوُا الْمَوْتَ اِنْ كُنْتُمْ صَادِقٖينَ ﴿٦﴾

---

**Allah-Təalanın lütf və mərhəmətidir, bəndələrindən hər bir şəxsə istəsə, verib onu peyğəmbər edər. Allah-Təala böyük fəzilət və mərhəmət sahibidir.**

**5) (**مَثَلُ الَّذٖينَ حُمِّلُوا التَّوْرٰيةَ ثُمَّ لَمْ يَحْمِلُوهَا كَمَثَلِ الْحِمَارِ يَحْمِلُ اَسْفَارًاۜ**)** - (Ey Məhəmməd), **Tövratı oxuyub, öyrənib, ehkamını dərk edəndən sonra ona əməl* etməyən şəxslərin** (yəhudilərin) **məsəli ulaq məsəli kimidir ki, böyük elm kitablarını daşıyar, amma onların ağırlıq və zəhmətindən başqa heç bir şey dərk etməz. Belə şəxslərlə ulaq arasında fərq yoxdur.**

**(*Qeyd:** *"Bu məsəli Tövrat əhli üçün qeyd etməkdən məqsəd biz Quran əhlini də xəbərdar etməkdir. Yəni Allah-Təalanın kitabına əməl etməyən şəxslərin məsəli ulaq məsəlidir. Siz Quran əhli də Tövrat əhli kimi olmayın ki, bu məsəl sizə də aid edilməsin. Bu məsəl alimlərə məxsusdur. Hər bir alim ki, Allah-Təalanın kitabına agah olandan sonra ona əməl etməsə, onunla ulaq arasında heç bir fərq yoxdur. Ancaq zahirdə insandır, batində isə ulağa bərabərdir. Həqiqətən, bu ayə adlarını alim qoyub, Quranın ehkamını gah istishabla (daha əvvəl var olan bir şeyin hələ də var olmasının zənn edilməsi), bəraətlə, gah "icma" (islam alimlərinin həmrəyliyi) və "xəbəri-vahid"lə və gah "isaleyi-ədəm" (yoxluğun var olması qanunu) və "qiyas"la (müqayisə) məhdudlaşdırıb, ya da ki hökmsüz edib tərk edənlərin analarını ağladıb, fəlakətə düçar olacağı xəbərini verən bir ayədir. Bəs alim adlananlar, özlərini təqlid edilməsi vacib olan şəxs və xalqa rəis sayanlar bu ayəyə diqqət etmirlər ki, Quranın ehkamını tərk edib, əsli olmayan və xəyalla tərtib edilən qaydalarla əvəz etməsinlər? Xüsusən alimlərdən bir qrup həmin surədə cümə namazının vacibliyinə qəti dəlil olan ayəni nəyə əsasən uydurma, dəlili olmayan xəbərlərlə hökmsüz sayıb, cümə namazının fərz olmamasını iddia edirlər? Hökmü açıq-aşkar olan ayəni yanlış yozub, ona şərtlər qoşmaq ayəni təhrif etmək deyilmi? ərəbcə ifadə).*

**(**بِئْسَ مَثَلُ الْقَوْمِ الَّذٖينَ كَذَّبُوا بِاٰيَاتِ اللّٰهِۜ**) Allah-Təalanın ayələrini təkzib edən, əməl etməyən şəxslərin məsəli nə yaman məsəldir ki, insan olduqları halda ulaq ilə eyni və bərabər olarlar. (**وَاللّٰهُ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمٖينَ**) Allah-Təala zalım camaatı** (o cümlədən Qurana əməl etməyənləri) haqq tərəfinə hidayət etməyib, lütf və rəhmətini onlara şamil etməyəcəkdir. (Yəhudilər deyirdilər: "Bizlər Allah-Təalanın dostu və yaxınlarıyıq, Allah-Təala qiyamət günü axirətdə bizə əzab etməyəcəkdir. Bu barədə növbəti ayə nazil oldu).

**6) (**قُلْ يَٓا اَيُّهَا الَّذٖينَ هَادُوٓا اِنْ زَعَمْتُمْ اَنَّكُمْ اَوْلِيَٓاءُ لِلّٰهِ مِنْ دُونِ النَّاسِ فَتَمَنَّوُا الْمَوْتَ اِنْ كُنْتُمْ صَادِقٖينَ**)** - (Ey Məhəmməd), **yəhudilərə de ki, əgər siz güman edirsiniz ki, axirətdə**

وَلَا يَتَمَنَّوْنَهُ اَبَدًا بِمَا قَدَّمَتْ اَيْدِيهِمْ ۜ وَاللّٰهُ عَلِيمٌ بِالظَّالِمِينَ ﴿٧﴾ قُلْ اِنَّ الْمَوْتَ الَّذِي تَفِرُّونَ مِنْهُ فَاِنَّهُ
مُلَاقِيكُمْ ثُمَّ تُرَدُّونَ اِلٰى عَالِمِ الْغَيْبِ وَالشَّهَادَةِ فَيُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ تَعْمَلُونَ ۟ ﴿٨﴾ يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُٓوا
اِذَا نُودِيَ لِلصَّلٰوةِ مِنْ يَوْمِ الْجُمُعَةِ فَاسْعَوْا اِلٰى ذِكْرِ اللّٰهِ وَذَرُوا الْبَيْعَ ۜ

---

**sizə əzab edilməyəcəkdir, bəs nə durubsunuz, ölümü təmənna edin ki, ölüm sizə gəlib, Allah-Təalanın öz dostlarından ötrü hazırladığı lütf və rəhmət evinə sizi nəql edib istirahət edəsiniz. Əgər doğru deyirsinizsə, əlbəttə bu təmənnanı edin.**

**7) (وَلَا يَتَمَنَّوْنَهُ اَبَدًا بِمَا قَدَّمَتْ اَيْدِيهِمْ ۜ وَاللّٰهُ عَلِيمٌ بِالظَّالِمِينَ)** - (Ey Məhəmməd), **yəhudilər özlərinin etdikləri küfr və günah səbəbi ilə heç vaxt ölümü təmənna etməzlər. Əgər təmənna etsələr, ölüm onlara gəlib, hamısı həlak olub, axirət əzabına düçar olacaqlar. Allah-Təala zalımların əhvalına agahdır. Qiyamət günündə zalımların cəzasını onlara yetirəcəkdir.**

**8) (قُلْ اِنَّ الْمَوْتَ الَّذِي تَفِرُّونَ مِنْهُ فَاِنَّهُ مُلَاقِيكُمْ)** - (Ey Məhəmməd), **de ki, o ölüm ki, ondan qaçırsınız, həqiqətən, o ölüm harda olsanız, sizə gələcəkdir və ondan xilas olmayacaqsınız. (ثُمَّ تُرَدُّونَ اِلٰى عَالِمِ الْغَيْبِ وَالشَّهَادَةِ فَيُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ تَعْمَلُونَ) - Ölüm sizə gələndən sonra aşkarı da, qeybi də bilən Allah-Təalanın tərəfinə qaytarılıb, dünyada etdiyiniz əməllərinizi sizə xəbər verib, əməllərinizin cəzasını sizə verəcəkdir. Növbəti ayə cümə namazının vacibliyi haqqında nazil olubdur. Cümə namazının fəziləti həddən çox olub, axirət faydasından başqa dünyada da din və millətə böyük faydalar verən bir ibadətdir. Ayədə heç bir şərt qoşulmadan onun vacib olması bəyan edilib və ancaq camaatla qılınmasına açıq-aşkar işarə edilibdir.**

**9) (يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُٓوا اِذَا نُودِيَ لِلصَّلٰوةِ مِنْ يَوْمِ الْجُمُعَةِ فَاسْعَوْا اِلٰى ذِكْرِ اللّٰهِ وَذَرُوا الْبَيْعَ ۜ) Ey möminlər, o zaman ki, namazdan ötrü cümə* günündə əzan verilib, namaz vaxtı elan olundu, alış-verişi tərk edib, xütbə və namaza gedin. O vaxt alış-veriş haramdır.**

**(*Qeyd:** *"Cümə gününə cahiliyyə zamanında ərəblər "ərubə" deyirdilər. O günü cümə adlandıran ilk şəxs peyğəmbərin əcdadlarından biri olan Kə`b ibn Lüey ibn Qalib oldu. Peyğəmbər (ə.s) Məkkədən hicrət edəndə öncə Qubada Bəni- Əmr ibn Əvf məhəlləsində məskən saldı. Orada Quba məscidini tikəndən sonra cümə günü oradan hərəkət edib, zöhr namazı vaxtı Bəni-Salim ibn Əvf məhəlləsinə gedib, orada cümə namazını qıldı. Bu ilk cümə namazı idi ki, ayənin gəlməsi səbəbi ilə peyğəmbər qıldı. Peyğəmbərin bircə müəzzini (Bilal) var idi. Allahın Rəsulu cümə günü xütbədən ötrü minbərə əyləşdiyində, müəzzin məscidin qapısında əzan oxuyardı. Minbərdən düşəndən sonra müəzzin iqamə deyib namaza başlayardılar. Habelə peyğəmbərdən sonra da Əbu Bəkir və Ömərin zamanında belə əməl edildi. Elə ki, xəlifəlik növbəsi Osmana çatdı, insanlar artıb, Mədinə*

ذٰلِكُمْ خَيْرٌ لَكُمْ اِنْ كُنْتُمْ تَعْلَمُونَ ﴿٩﴾ فَاِذَا قُضِيَتِ الصَّلٰوةُ فَانْتَشِرُوا فِي الْاَرْضِ وَابْتَغُوا مِنْ فَضْلِ
اللّٰهِ وَاذْكُرُوا اللّٰهَ كَثِيرًا لَعَلَّكُمْ تُفْلِحُونَ ﴿١٠﴾ وَاِذَا رَاَوْا تِجَارَةً اَوْ لَهْوًا اِنْفَضُّوا اِلَيْهَا وَتَرَكُوكَ قَائِمًا

---

*də böyüdüyü üçün, evlər məsciddən uzaq olduğuna görə bir müəzzin də əlavə etdi. Elə ki, cümə günü olurdu, Osman Zəvradakı evindən namaz üçün çıxanda birinci müəzzin Osmanın evində əzan oxuyardı. O zaman ki, məscidə gedib, xütbədən ötrü minbərdə əyləşirdi, o biri müəzzin məscidin qapısında əzan oxuyub, xəlifə də xütbə ilə məşğul olardı. Səhabələrdən heç kim bu əməli Osmana eyib saymadı və bu səbəbdən o əməlin caizliyi məlum oldu və həm də cümə namazında namazdan əvvəl gərək xütbə oxunsun. Xütbədə Allah-Təalaya həmd-səna edib, peyğəmbərə salavat deyəndən sonra camaata nəsihət və vəz etmək lazımdır. Ayədəki "zikrullah" xütbə və namazdan ibarətdir. Osman ibn Əffan elə ki, xəlifəliyə nail oldu, ilk cümə günü xütbədən ötrü minbərə çıxdı, camaat toplanıb, izdiham oldu. Osman xütbəyə başladı. Allaha həmd-səna edib, sakit olub daha xütbənin arxasını deyə bilmədi. Ondan sonra başladı: "həqiqətən, Əbu Bəkir və Ömər bu gündə xütbədən ötrü vaxtından əvvəl tədarük görüb, sözlər hazır edirdilər. Sizin iş görən imama ehtiyacınız xütbə oxuyub danışan imama ehtiyacınızdan çoxdur. Bundan sonra sizə xütbələr gəlir" deyərək, minbərdən düşdü. Bu əməl səhabələrin hüzurunda oldu, heç bir nəfər də ona qarşı çıxmadı. Bu, dəlildir ki, əgər cümədə xütbəyə az zaman ayrılsa da kifayət edər).*

**(ذٰلِكُمْ خَيْرٌ لَكُمْ اِنْ كُنْتُمْ تَعْلَمُونَ) - Əgər cümə namazının nə qədər xeyirli bir əməl olmasına agah olsanız, onu yerinə yetirmək sizin üçün xeyirli olar, əlbəttə cümə namazını gərək qılıb, tərk etməyəsiniz.**

**10) (فَاِذَا قُضِيَتِ الصَّلٰوةُ فَانْتَشِرُوا فِي الْاَرْضِ وَابْتَغُوا مِنْ فَضْلِ اللّٰهِ) - O zaman ki, cümə namazı bitdi, o vaxt da yer üzünə dağılıb, alış-veriş edib, Allah-Təalanın lütf və mərhəmətindən ruzi istəyin. (وَاذْكُرُوا اللّٰهَ كَثِيرًا لَعَلَّكُمْ تُفْلِحُونَ) Allah-Təalanı çox zikr edib, heç bir halda Allahın zikrindən qafil olmayın, belə olan halda əlbəttə, nicat tapıb, əbədi savaba yetişəcəksiniz.** (Mədinə əhli bir il qıtlıq və aclığa düçar oldular, cümə günü peyğəmbər xütbə oxuyarkən, Dihyə ibn Xəlifə Şamdan ərzaq gətirib, Mədinəyə varid oldu. Məscid əhli bundan xəbərdar olub, peyğəmbəri xütbə halında qoyub, dağıldılar. Ancaq bir neçə nəfər qaldı. Bu barədə növbəti ayə nazil oldu).

**11) (وَاِذَا رَاَوْا تِجَارَةً اَوْ لَهْوًا اِنْفَضُّوا اِلَيْهَا وَتَرَكُوكَ قَائِمًا)** - (Ey Məhəmməd), **o zaman ki, müsəlmanlar bir ticarət, ya da ki, bir oyun və boş bir əməl** (təbil-şeypur çalınmasını) **gördülər,** (karvan qabağına çıxanda təbil-şeypur çala-çala çıxardılar) **səni xütbə oxuyan halda, ayaqüstündə qoyub, o tərəfə gedərlər. Bu yaxşı əməl deyildir.**

قُلْ مَا عِنْدَ اللهِ خَيْرٌ مِنَ اللَّهْوِ وَمِنَ التِّجَارَةِ وَاللهُ خَيْرُ الرَّازِقِينَ ﴿١١﴾

---

**(قُلْ مَا عِنْدَ اللهِ خَيْرٌ مِنَ اللَّهْوِ وَمِنَ التِّجَارَةِ وَاللهُ خَيْرُ الرَّازِقِينَ)** - (Ey Məhəmməd), **onlara de ki, Allah-Təalanın yanında cümə namazından ötrü təqdir edilən əcr və savab əyləncədən və ticarətdən yaxşıdır. Ruzidən ötrü peyğəmbəri orada qoyub dağılırsınız. Ruzi verənlərin yaxşısı Allah-Təaladır. Ruzini gərək Allah-Təaladan istəyəsiniz, Allah-Təalanın əmrini tərk edib, ruzidən ötrü getməkdən fayda hasil olmaz.**

**Allaha həmd olsun. Cümə surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: "Kim Cümə surəsini oxusa, Allah-Təala ona on savab bəxş edər.**

# əl-MÜNAFİQUN SURƏSİ

63-cü surədir. Mədinədə nazil olub, 11 ayə, 180 kəlmə və 976 hərfdir.

**Bismillahir-Rəhmanir-Rəhim**

Yəhudilərin Bəni-Müstəliq tayfası Mədinədən bir neçə mil kənarda yaşayırdılar. Savaş tədarükü görüb, yurdlarından çıxıb, Mədinədə peyğəmbərlə savaşmaq üçün hazırlaşmağa başladılar. Bu xəbər peyğəmbərə çatdı, mühacirləri, ənsarı və digər müsəlmanları toplayıb, onlar Mədinəyə çatmamış, Mürəyəsi adlı suyun yanında onlarla qarşılaşıb savaşdılar. Bəni-Müstəliq camaatının rəisi sonralar peyğəmbərin xanımı olan Cüveyriyənin atası Haris ibn Əbu Zirar idi. Savaş şiddətlənib, Allah-Təala müsəlmanlara qüvvət verib, Bəni-Müstəliq camaatını məğlub etdilər. Mədinədə olan münafiqlərin başçısı olan Abdullah ibn Übeyy də o savaşda iştirak edirdi. Savaş bitəndən sonra müsəlmanlar quyudan su çəkməyə başladılar. Cəhcah ibn Səidlə Abdullah ibn Übeyyin andlısı (himayəsi altında olan) Sinan ilə mübahisəsi oldu. Cəhcah mühacirləri, Sinan ənsarı köməyə çağırdı. Kasıb bir mühacir olan Cial adlı bir şəxs Cəhcaha kömək gəlib Sinana bir sillə vurdu. Abdullah ibn Übeyy gəlib Ciala dedi: “Sən cəsarət edib belə iş görürsən?” Cial dedi: “Kim mənə mane ola bilər? Abdullah qəzəblənib dedi: “Biz Məhəmmədə yoldaş olmadıq ki, bizə sillə vursınlar. Bizimlə sizin məsələniz o şəxs deyən kimidir: “Köpəyini kökəlt ki, səni yesin, and olsun Allah-Təalaya, qoy Mədinəyə qayıdaq, əlbəttə, əziz olan (özünü deyir) zəlil olanı (Məhəmmədi) Mədinədən çıxarar. Ondan sonra öz qövmünə xitab edib dedi: “Bu nədir özünüzə etdiniz? Vilayətinizdə onlara yer verib, mallarınızı onlarla bölüşdürdünüz, and olsun Allah-Təalaya, əgər yeməklərinizin artığını Cial və onun kimi şəxslərdən əsirgəyib, onlara verməsəydiniz, indi sizin boynunuza minməyib, qayıdıb gedərdilər. İndi bunlara bir şey verməyin ki, qoy Məhəmmədin yanından dağılsınlar. Abdullah ibn Übeyyin qövmünün arasında Zeyd İbn Ərqam adlı bir yeniyetmə də var idi. Bu sözü Abdullahdan eşidib dedi: “And olsun Allah-Təalaya, zəlil və qövmünün arasında nifrət edilən sənsən. Məhəmməd Allah-Təala tərəfindən əziz, müsəlmanların arasında qüvvətlidir. Abdullah dedi: “Sakit ol, mən zarafat edirdim. Zeyd ibn Ərqam bu hadisəni peyğəmbərə xəbər verdi. Ömər dedi: “Ey peyğəmbər, izin ver, bu münafiqin başını kəsim. Buyurdu: “O zaman Mədinədə çox şəxslərin başını bəlaya salarsan. Ömər dedi: “Əgər mühacirlərin onu qətl etməsini istəmirsənsə, bu ənsari kişiyə əmr et, onu qətl etsin. Buyurdu: “Camaat da desin ki, Məhəmməd öz səhabələrini qətl edir?

Ya Ömər, bu işdən vaz keç, elan et ki, yola düşsünlər. Peyğəmbər elə bir vaxtda yola düşməyi əmr etdi ki, heç vaxt o saatda yola çıxmazdılar. Camaat hazırlaşmağa başladı. Peyğəmbər Abdullah ibn Übeyyi çağırtdırdı. Abdullah gəldi. Buyurdu: “Bəs sən belə bir söz demisən? Abdullah dedi: “And olsun sənə kitab göndərən Allah-Təalaya ki, məndən belə söz çıxmayıbdır, Zeyd yalan deyir. Abdullah Mədinədə mötəbər şəxs olduğuna görə ənsardan orda olan səhabələr dedilər: “Ey peyğəmbər, Zeyd uşaqdır, ola bilər ki, düz eşitməyib. Peyğəmbər Abdullahın üzrxahlığını qəbul edib, Zeydi ənsar arasında məzəmmət etdi. Zeyd həmişə peyğəmbərin önündə gedib, miniyinin üzəngisini tutardı. Ondan sonra utanıb, kənara çəkildi. Peyğəmbər yola düşdü. Yol əsnasında Abdullahın camaatından Üseyd ibn Hüzeyr peyğəmbərin yanına gəlib, salam verib dedi: “Ey peyğəmbər, pis vaxtda yola düşdük. Buyurdu: “Bəs eşitmədin ki, yoldaşınız Abdullah nə deyibdir? Üseyd soruşdu: “Nə deyibdir? Buyurdu: özünə əziz, mənə zəlil deyib, məni Mədinədən çıxaracağını deyib. Üseyd dedi: “Ey peyğəmbər, vallah əziz sənsən, zəlil odur. “Ey peyğəmbər, gərək onunla elə rəftar edəsiniz ki, bir zamanlar ona tac qoyub, onu padşah etmək istəyirdilər. Allah-Təala səni Mədinəyə gətirdi, onun padşahlığı batil oldu və bu səbəbdən səni sevmir. Gərək ondan üz döndərəsən. Abdullahın oğlu Abdullah bu mətləbi eşidib peyğəmbərin hüzuruna gəlib dedi: “Ey peyğəmbər, eşitmişəm atam Abdullahı qətl etdirmək istəyirsən, əgər həqiqətən, onu qətl etdirəcəksənsə, əmr et, mən özüm onun başını sənə gətirim. Vallah, Xəzrəc camaatının (Abdullahın camaatı) hamısı bilir ki, onların arasında məndən çox valideyninə itaət edən yoxdur. Mən qorxuram ki, məndən başqasına atamı qətl etməsini əmr edəsən, o da onu qətl etsin, o vaxt mən atamın qatilinin yer üzündə sağ gəzməsinə dözə bilməyib, onu qətl edim, bir mömini kafirin əvəzinə öldürüb, cəhənnəmə daxil olam. Allahın Rəsulu buyurdu: “Nə yalan sözlərdir, əksinə onunla yaxşı rəftar edib, ona güzəşt edəcəyik. Abdullahın sözü camaatın arasında yayıldı. Peyğəmbər o gecə ertəsi gün günortaya kimi yol gedib, zöhr vaxtı bir yerdə dayandı. Yerə ayağı dəyən kimi hamısı yatdı. Peyğəmbərin gecə-gündüz hərəkət etməkdə məqsədi Abdullahın sözünü camaatın yadından çıxartmaq idi. Ondan sonra gedib, Mədinəyə varid oldular. Zeyd evində əyləşib, utandığından evdən çıxmadı. O zaman Münafiqin surəsi nazil oldu. Peyğəmbər Zeydi çağırtdırıb, qulağından tutub dedi: “Qulağın düz eşidib, Allah-Təala səni təsdiq edib, münafiqləri (Abdullah ibn Übeyyi və onun yoldaşlarını) yalanladı. Münafiqin surəsi budur ki, qeyd olunur.

**1) (اِذَا جَٓاءَكَ الْمُنَافِقُونَ قَالُوا نَشْهَدُ اِنَّكَ لَرَسُولُ اللّٰهِۘ)** - (Ey Məhəmməd), **o zaman ki,** (Zeyd ibn Ərqam Abdullah ibn Übeyyin) **münafiqin sözünü sənə xəbər verdi, münafiqlər gəlib dedilər: “Biz şəhadət edirik ki, həqiqətən, sən Allah-**

وَاللّٰهُ يَعْلَمُ اِنَّكَ لَرَسُولُهُۜ وَاللّٰهُ يَشْهَدُ اِنَّ الْمُنَافِقِينَ لَكَاذِبُونَۚ ﴿١﴾ اِتَّخَذُٓوا اَيْمَانَهُمْ جُنَّةً فَصَدُّوا عَنْ سَبِيلِ اللّٰهِۜ اِنَّهُمْ سَٓاءَ مَا كَانُوا يَعْمَلُونَ ﴿٢﴾ ذٰلِكَ بِاَنَّهُمْ اٰمَنُوا ثُمَّ كَفَرُوا فَطُبِعَ عَلٰى قُلُوبِهِمْ فَهُمْ لَا يَفْقَهُونَ ﴿٣﴾ وَاِذَا رَاَيْتَهُمْ تُعْجِبُكَ اَجْسَامُهُمْۜ وَاِنْ يَقُولُوا تَسْمَعْ لِقَوْلِهِمْۜ كَاَنَّهُمْ خُشُبٌ مُسَنَّدَةٌۜ يَحْسَبُونَ كُلَّ صَيْحَةٍ عَلَيْهِمْۜ

---

**Təalanın peyğəmbərisən. Sənin haqqında elə söz demək layiq deyildir, bəlkə də** (Zeyd) **yalançıdır.**

**(وَاللّٰهُ يَعْلَمُ اِنَّكَ لَرَسُولُهُۜ)** - (Ey Məhəmməd), **münafiqlər səni təsdiq edib deyirlər: "Həqiqətən, səni qəlbən təsdiq edirik və Allah-Təala da agahdır ki, həqiqətən, sən onun peyğəmbərisən. Bunda heç bir şəkk və şübhə yoxdur. (وَاللّٰهُ يَشْهَدُ اِنَّ الْمُنَافِقِينَ لَكَاذِبُونَۚ) Amma Allah-Təala şəhadət edir ki, münafiqlər o söz ki, sənə deyirlər, guya səni peyğəmbər sayıb, qəlbləri və dilləri ilə təsdiq edirlər, əslində yalançıdırlar, dilləri ilə səni təsdiq edib, qəlbləri ilə təkzib edirlər.** (Zeyd) **doğru, münafiqlər yalançıdırlar.**

**2) (اِتَّخَذُٓوا اَيْمَانَهُمْ جُنَّةً فَصَدُّوا عَنْ سَبِيلِ اللّٰهِۜ اِنَّهُمْ سَٓاءَ مَا كَانُوا يَعْمَلُونَ)** - (Ey Məhəmməd), **münafiqlər and içməyi özlərinə** (savaşda zireh kimi) **müdafiə səbəbi sayıb, and içib, küfrlərini gizlədirlər ki, qətldən nicat tapsınlar. Bununla belə insanların da Allah-Təalanın dininə daxil olmalarına mane olurlar. Həqiqətən, münafiqlər nə pis əməl edib, küfrü imana üstün sayırlar.**

**3) (ذٰلِكَ بِاَنَّهُمْ اٰمَنُوا ثُمَّ كَفَرُوا فَطُبِعَ عَلٰى قُلُوبِهِمْ فَهُمْ لَا يَفْقَهُونَ) - Onların bu pis əməlləri o səbəbədir ki, kəlmeyi-şəhadət deyib, imanlarını bildirdilər. Ondan sonra qəlblərində olan küfr və nifaqlarını göstərdilər və bu səbəbdən onların qəlblərinə nifaqları səbəbinə elə bir möhür vurulubdur ki, hələ imana daxil olmayıb, belə zidd əməllərə cəsarət edirlər. Quranın haqq olmasını düşünməyib, dərk etmirlər.**

**4-5) (وَاِذَا رَاَيْتَهُمْ تُعْجِبُكَ اَجْسَامُهُمْۜ)** - (Ey Məhəmməd), **o zaman ki, sən münafiqləri görürsən, onların boy-buxunları, gözəl surətləri səni təəccübləndirir,** (münafiqlərdən Abdullah ibn Übeyy və digərləri uca qamətli, xoş surətli, fəsih danışıqlı şəxslər idilər).

**(وَاِنْ يَقُولُوا تَسْمَعْ لِقَوْلِهِمْۜ) Söz danışanda onlara qulaq asıb, fəsahətli nitqlərindən ləzzət alırsan. (كَاَنَّهُمْ خُشُبٌ مُسَنَّدَةٌۜ يَحْسَبُونَ كُلَّ صَيْحَةٍ عَلَيْهِمْۜ)** - (Ey Məhəmməd), **onların uca qamətlərinə, gözəl surətlərinə, şirin danışıqlarına baxmayın, onlar işə yaramayan, gərəksiz olub, bir tərəfdə divara söykənib qalan bir kötük kimidirlər, ruhsuz və qəlbsiz boş qəfəsdirlər. Bir səs eşidəndə onu özlərinin zərərinə hesab edib, qorxudan az qalır bağırları yarılsın.**

هُمُ الْعَدُوُّ فَاحْذَرْهُمْ ۚ قَاتَلَهُمُ اللّٰهُ ۚ اَنّٰى يُؤْفَكُونَ ﴿٤﴾ وَاِذَا قِيلَ لَهُمْ تَعَالَوْا يَسْتَغْفِرْ لَكُمْ رَسُولُ اللّٰهِ
لَوَّوْا رُؤُسَهُمْ وَرَاَيْتَهُمْ يَصُدُّونَ وَهُمْ مُسْتَكْبِرُونَ ﴿٥﴾ سَوَآءٌ عَلَيْهِمْ اَسْتَغْفَرْتَ لَهُمْ اَمْ لَمْ تَسْتَغْفِرْ
لَهُمْ ۚ لَنْ يَغْفِرَ اللّٰهُ لَهُمْ ۚ اِنَّ اللّٰهَ لَا يَهْدِي الْقَوْمَ الْفَاسِقِينَ ﴿٦﴾ هُمُ الَّذِينَ يَقُولُونَ لَا تُنْفِقُوا عَلٰى مَنْ
عِنْدَ رَسُولِ اللّٰهِ حَتّٰى يَنْفَضُّواۜ وَلِلّٰهِ خَزَآئِنُ السَّمٰوَاتِ وَالْاَرْضِ وَلٰكِنَّ الْمُنَافِقِينَ لَا يَفْقَهُونَ ﴿٧﴾

---

**(هُمُ الْعَدُوُّ فَاحْذَرْهُمْ) - O münafiqlər sizə olan düşmənçiliklərini artırıblar, onların zahirlərinə aldanmayıb, heç bir işdə onlara etimad etməyib, onlardan çəkinin. (قَاتَلَهُمُ اللّٰهُ ۚ اَنّٰى يُؤْفَكُونَ) Allah-Təala öldürsün onları, necə də haqdan dönüb, batildən yapışırlar?** (Elə ki, bu ayələr münafiqlər haqqında nazil oldu, Abdullah ibn Übeyyə dedilər: “Sənin haqqında şiddətli ayələr nazil olubdur. Peyğəmbərin hüzuruna get, Allahdan sənin əfv edilməni istəsin. Abdullah başını qaldırıb dedi: “İman etməmi əmr etdiniz, iman etdim, malımdan zəkat verməmi əmr etdiniz, zəkat verdim. İndi bir o qalıb ki, gərək Məhəmmədə səcdə eləyim. O vaxt bu növbəti ayə nazil oldu).

**(وَاِذَا قِيلَ لَهُمْ تَعَالَوْا يَسْتَغْفِرْ لَكُمْ رَسُولُ اللّٰهِ لَوَّوْا رُؤُسَهُمْ وَرَاَيْتَهُمْ يَصُدُّونَ وَهُمْ مُسْتَكْبِرُونَ)** - (Ey Məhəmməd), **o zaman ki, möminlər münafiqlərə** (Abdullaha və onun kimilərə) **dedilər: “Gərək Allahın Rəsulu sizin əfv edilmənizi istəsin, bu sözü eşidəndə** (Ey Məhəmməd), **baxıb görürsən ki, başlarını çevirib, təkəbbürləndikləri halda sənin onların bağışlanmalarını istəməndən üz döndərirlər.**

**6) (سَوَآءٌ عَلَيْهِمْ اَسْتَغْفَرْتَ لَهُمْ اَمْ لَمْ تَسْتَغْفِرْ لَهُمْ ۚ لَنْ يَغْفِرَ اللّٰهُ لَهُمْ ۚ اِنَّ اللّٰهَ لَا يَهْدِي الْقَوْمَ الْفَاسِقِينَ)** - (Ey Məhəmməd), **münafiqlərin əfv edilməsini istəyəsən, ya istəməyəsən, onlarçün eynidir. Bağışlanmağa etimadları yoxdur. Allah-Təala da onları əbədiyyən bağışlamayacaqdır. Belə fasiqlərin əfv edilməsini istəmək lazım deyildir. Həqiqətən, Allah-Təala günahlarında sabit və bərqərar olan camaatı haqq tərəfinə hidayət edən deyildir.**

**7) (هُمُ الَّذِينَ يَقُولُونَ لَا تُنْفِقُوا عَلٰى مَنْ عِنْدَ رَسُولِ اللّٰهِ حَتّٰى يَنْفَضُّواۜ)** - (Ey Məhəmməd), **münafiqlər həmin şəxslərdirlər ki, bir-birilərinə dedilər: “Allahın Rəsulunun ətrafında olan kasıb mühacirlərə yeməklərinizin artığını verməyin ki, onun ətrafından dağılıb getsinlər. Onun işi batil olsun.**

**(وَلِلّٰهِ خَزَآئِنُ السَّمٰوَاتِ وَالْاَرْضِ وَلٰكِنَّ الْمُنَافِقِينَ لَا يَفْقَهُونَ) - Münafiqlər kasıb mühacirlərə bir şey verməyəndə elə xəyal edirdilər ki, onlar aclıqdan həlak olarlar, halbuki göylərin və yerin xəzinələri Allah-Təalaya məxsusdur. Əgər Allah-Təala yağış və qar göndərməyib, yer üzündə əkin və digər meyvələr əmələ gətirməsə, münafiqlər də acından həlak olarlar. Lakin münafiqlər bu mətləbi anlamayıb, şeytan onların sözlərinə zinət verib, boş-boş danışırlar.**

يَقُولُونَ لَئِنْ رَجَعْنَٓا اِلَى الْمَدٖينَةِ لَيُخْرِجَنَّ الْاَعَزُّ مِنْهَا الْاَذَلَّ ۜ وَلِلّٰهِ الْعِزَّةُ وَلِرَسُولِهٖ وَلِلْمُؤْمِنٖينَ وَلٰكِنَّ الْمُنَافِقٖينَ لَا يَعْلَمُونَ ۟﴿٨﴾ يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوا لَا تُلْهِكُمْ اَمْوَالُكُمْ وَلَٓا اَوْلَادُكُمْ عَنْ ذِكْرِ اللّٰهِ ۚ وَمَنْ يَفْعَلْ ذٰلِكَ فَاُو۬لٰٓئِكَ هُمُ الْخَاسِرُونَ ﴿٩﴾ وَاَنْفِقُوا مِمَّا رَزَقْنَاكُمْ مِنْ قَبْلِ اَنْ يَأْتِيَ اَحَدَكُمُ الْمَوْتُ فَيَقُولَ رَبِّ لَوْلَٓا اَخَّرْتَنٖٓي اِلٰٓى اَجَلٍ قَرٖيبٍۙ فَاَصَّدَّقَ وَاَكُنْ مِنَ الصَّالِحٖينَ﴿١٠﴾ وَلَنْ يُؤَخِّرَ اللّٰهُ نَفْسًا اِذَا جَٓاءَ اَجَلُهَاۜ

---

**8) (يَقُولُونَ لَئِنْ رَجَعْنَٓا اِلَى الْمَدٖينَةِ لَيُخْرِجَنَّ الْاَعَزُّ مِنْهَا الْاَذَلَّ ۜ)** - (Ey Məhəmməd), **münafiqlər** (Abdullah və onun yoldaşları Bəni əl-Müstəliq savaşından qayıdan zamanda) **dedilər: "Əgər Mədinəyə qayıtsaq, əziz olan** (Abdullah ibn Übeyy) **zəlil olanı** (səni Ey Məhəmməd), **əlbəttə Mədinədən çıxarar.**

(وَلِلّٰهِ الْعِزَّةُ وَلِرَسُولِهٖ وَلِلْمُؤْمِنٖينَ وَلٰكِنَّ الْمُنَافِقٖينَ لَا يَعْلَمُونَ) **Səni Mədinədən necə çıxarırlar? Halbuki münafiqlərin bir izzəti yoxdur. İzzət* Allah-Təalaya və onun peyğəmbərinə və möminlərə məxsusdur. Lakin münafiqlər bu mətləbə agah olmayıb, izzəti özlərinə məxsus edirlər.**

**(*Qeyd:** *"Bir kişi imam Həsən ibn Əliyə (ə.s) dedi: "Camaat belə güman edir ki, səndə təkəbbür var. Buyurdu: xeyr, təkəbbür deyildir. Əksinə ayədə göstərilən möminlərə məxsus olan izzətdir, ondan sonra ayəni oxudu).*

**9) (يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوا لَا تُلْهِكُمْ اَمْوَالُكُمْ وَلَٓا اَوْلَادُكُمْ عَنْ ذِكْرِ اللّٰهِ ۚ) Ey möminlər, mallarınızla ticarət edib onu artırmaq üçün səy etmək, habelə övladınızın işlərini islah edib, onlardan ləzzət alıb, şad olmanız sizi Allah-Təalanın zikrindən məşğul və qafil etməsin. (وَمَنْ يَفْعَلْ ذٰلِكَ فَاُو۬لٰٓئِكَ هُمُ الْخَاسِرُونَ) - O şəxslər ki, mal və övlad səbəbi ilə Allah-Təalanın zikrindən qafil olur, elə şəxslər ticarətlərində ziyankar olub, böyük və daimi şeyləri həqir və fani şeyə satmış olarlar.**

**10) (وَاَنْفِقُوا مِمَّا رَزَقْنَاكُمْ مِنْ قَبْلِ اَنْ يَأْتِيَ اَحَدَكُمُ الْمَوْتُ) Ey möminlər, ölüm sizə gəlməmiş sizə verdiyimiz ruzilərdən xərcləyin.**

**(فَيَقُولَ رَبِّ لَوْلَٓا اَخَّرْتَنٖٓي اِلٰٓى اَجَلٍ قَرٖيبٍۙ فَاَصَّدَّقَ وَاَكُنْ مِنَ الصَّالِحٖينَ) - Əgər xərcləməsə, ölüm ona gələndən sonra deyəcəkdir: "Ey mənim rəbbim, niyə mənim ölümümü az bir müddət daha təxirə salmadın ki, malımdan sədəqə verib, xərcləyib, saleh şəxslərdən olaydım. Dünyada mənim ruhumu tez aldın, o səbəbdən xərcləməm mümkün olmadı.** (Bəs belə şəxsin cavabında Allah-Təala nə desin? Növbəti ayədə cavab verəcəyi kimi əvvəl keçən başqa bir surədə də "Sizə düşünəcək şəxsin düşünəcəyi qədər bir ömür vermədikmi?" şəklində cavab veribdir).

**11) (وَلَنْ يُؤَخِّرَ اللّٰهُ نَفْسًا اِذَا جَٓاءَ اَجَلُهَاۜ)** (Cavab budur:) **sizə dünyada ömür verib, ölümü sizdən təxirə saldım. Heç bir xeyir əmələ yönəlmədiniz. Elə**

وَاللّٰهُ خَبِيرٌ بِمَا تَعْمَلُونَ ﴿١١﴾

---

**ki, bir şəxsin müəyyən edilmiş vaxtı yetişdi, daha heç vaxt Allah-Təala onun ölümünü təxirə salmaz və ona möhlət verilməz. Dünyaya qayıtmaq təmənnası boş və əbəsdır. (وَاللّٰهُ خَبِيرٌ بِمَا تَعْمَلُونَ) Hər bir əməlinizə Allah-Təala xəbərdardır və agahdır. Ona görə sizə cəza verəcəkdir.**

Allaha həmd olsun. Münafiqun surəsinin təfsiri tamamlandı. Bu mübarək surədə münafiqlərin sonu və Allahın Rəsulu kimi möhtərəm bir peyğəmbərin onlar üçün əfv istəməsinin də onlara fayda verməyib, əfv etmənin Allah-Təalanın məmnunluğuna bağlı olması bəyan edilmişdir. Münafiq (Abdullah) vəfat edəndə oğlu Abdullah peyğəmbərin yanına gedib, onun üçün cənazə namazı qılmasını xahiş etdi. Peyğəmbər onun xahişini qəbul edib, ona namaz qılmağa başlayanda Ömər ibn Xəttab peyğəmbərin xirqəsindən tutub dedi: “Ey peyğəmbər, belə münafiqə namaz qılırsan? Buyurdu: “Burax məni, ya Ömər, mənim namazımın ona nə faydası var? Həmin hədisi bizim əməlsiz arzularımızı və əfv edilmə ümidimizi batil edir. Allahın Rəsulu buyurdu: “Kim Münafiqun surəsini oxusa, nifaqdan uzaq olar. Əlbəttə, nifaqın xəbisliyinə, aqibətinin qorxulu olmasına bu mübarək surə vasitəsi ilə agah olan şəxs özünü münafiqlərin qatarından uzaq edər.

## ət-TƏĞABÜN SURƏSİ

64-cü surədir. Mədinədə nazil olub, 8 ayə, 241 kəlmə və 1070 hərfdir.

يُسَبِّحُ لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۚ لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُۘ وَهُوَ عَلٰى كُلِّ شَيْءٍ قَدٖيرٌ
﴿١﴾ هُوَ الَّذٖي خَلَقَكُمْ فَمِنْكُمْ كَافِرٌ وَمِنْكُمْ مُؤْمِنٌۜ وَاللّٰهُ بِمَا تَعْمَلُونَ بَصٖيرٌ ﴿٢﴾ خَلَقَ السَّمٰوَاتِ
وَالْاَرْضَ بِالْحَقِّ وَصَوَّرَكُمْ فَاَحْسَنَ صُوَرَكُمْۚ وَاِلَيْهِ الْمَصٖيرُ ﴿٣﴾ يَعْلَمُ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِ
وَيَعْلَمُ مَا تُسِرُّونَ وَمَا تُعْلِنُونَۜ وَاللّٰهُ عَلٖيمٌ بِذَاتِ الصُّدُورِ ﴿٤﴾ اَلَمْ يَاْتِكُمْ نَبَؤُا الَّذٖينَ كَفَرُوا مِنْ
قَبْلُۘ فَذَاقُوا وَبَالَ اَمْرِهِمْ وَلَهُمْ عَذَابٌ اَلٖيمٌ ﴿٥﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (يُسَبِّحُ لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۚ لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُۘ وَهُوَ عَلٰى كُلِّ شَيْءٍ قَدٖيرٌ) **Göylərdə və yerdə olan hər bir şey** (varlıqları ilə) **Allah-Təalanı zikr edib, pak və müqəddəs sayarlar. Hər bir şeyə malik olmaq və hər bir həmd edənin həmd-sənası da Allah-Təalaya məxsusdur. Allah-Təalaya bir mane olan olmayıb, o, hər bir şeyə qadirdir.**

**2)** (هُوَ الَّذٖي خَلَقَكُمْ فَمِنْكُمْ كَافِرٌ وَمِنْكُمْ مُؤْمِنٌۜ) **Allah-Təala öz kamil qüdrəti ilə mərhəmət edib, əsl vücud nemətini sizə verib, sizi yoxdan yaratdı. Gərək siz haqqı görən gözlə diqqətlə baxıb hamınız şükür edən və iman əhli olaydınız, lakin siz buna qadir olduğunuz halda diqqətlə baxmayıb, iki qrup oldunuz. Bəziniz haqdan uzaq kafir oldunuz, bəziniz də haqqı dərk edib mömin oldunuz.** (وَاللّٰهُ بِمَا تَعْمَلُونَ بَصٖيرٌ) **Allah-Təala sizin öz ixtiyarınızla qazandığınız küfr və imandan agahdır. Ona görə sizə qarşılıq verəcəkdir.**

**3)** (خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ بِالْحَقِّ) **Allah-Təala göyləri və yeri siz insanlar üçün məqsəd və hikmət üzrə yaratdı.** (وَصَوَّرَكُمْ فَاَحْسَنَ صُوَرَكُمْۚ وَاِلَيْهِ الْمَصٖيرُ) **- Və canlılar arasından siz insanlara gözəl surət verib, sizi digər canlılardan üstün etdi. Ölüm sizə gələndən sonra qayıdacağınız yer Allah-Təalanın tərəfinədir.**

**4-5)** (يَعْلَمُ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِ وَيَعْلَمُ مَا تُسِرُّونَ وَمَا تُعْلِنُونَۜ وَاللّٰهُ عَلٖيمٌ بِذَاتِ الصُّدُورِ) **Göylərdə, yerdə olan hər bir şeyə, siz insanların gizlədib və aşkar etdiyiniz şeylərin hamısına və sinələrdə olan sirlərə Allah-Təala agahdır. Külli və cüzi hər şey Allah-Təalanın elminə daxil olub, ona məxfi qalan deyildir. Belə həqiqi alimdən çəkinib, onun əmr və qadağalarına müxalifət etməmək lazımdır.** (اَلَمْ يَاْتِكُمْ نَبَؤُا الَّذٖينَ كَفَرُوا مِنْ قَبْلُۘ فَذَاقُوا وَبَالَ اَمْرِهِمْ وَلَهُمْ عَذَابٌ اَلٖيمٌ) **-**

ذٰلِكَ بِاَنَّهُ كَانَتْ تَاْتِيهِمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ فَقَالُوٓا اَبَشَرٌ يَهْدُونَنَاۘ فَكَفَرُوا وَتَوَلَّوْا وَاسْتَغْنَى اللّٰهُۜ وَاللّٰهُ غَنِيٌّ
حَمِيدٌ ﴿٦﴾ زَعَمَ الَّذِينَ كَفَرُوٓا اَنْ لَنْ يُبْعَثُواۜ قُلْ بَلٰى وَرَبِّي لَتُبْعَثُنَّ ثُمَّ لَتُنَبَّؤُنَّ بِمَا عَمِلْتُمْۜ وَذٰلِكَ عَلَى
اللّٰهِ يَسِيرٌ ﴿٧﴾ فَاٰمِنُوا بِاللّٰهِ وَرَسُولِهِ وَالنُّورِ الَّذِيٓ اَنْزَلْنَاۜ وَاللّٰهُ بِمَا تَعْمَلُونَ خَبِيرٌ ﴿٨﴾ يَوْمَ يَجْمَعُكُمْ
لِيَوْمِ الْجَمْعِ ذٰلِكَ يَوْمُ التَّغَابُنِۜ وَمَنْ يُؤْمِنْ بِاللّٰهِ وَيَعْمَلْ صَالِحًا يُكَفِّرْ عَنْهُ سَيِّاٰتِهِ وَيُدْخِلْهُ جَنَّاتٍ
تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَآ اَبَدًاۜ ذٰلِكَ الْفَوْزُ الْعَظِيمُ﴿٩﴾

---

**Bəs siz kafir və münafiqlərə sizdən əvvəlki peyğəmbərlərə kafir olanların xəbəri gəlib çatmayıbdır ki, kafir olduqları üçün onlara əzab gəlib, həlak oldular. Öz küfr və nifaqlarının cəzasını dünyada dadıb, axirətdə də onlardan ötrü əziyyət verən əzab vardır.**

**6) (ذٰلِكَ بِاَنَّهُ كَانَتْ تَاْتِيهِمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ فَقَالُوٓا اَبَشَرٌ يَهْدُونَنَاۘ) - Əvvəlkilərin dünyada əməllərinin cəzasını dadıb, axirətdə də onlara əzab edilməsinin səbəbi odur ki, onların peyğəmbərləri doğruluqlarına işarə edən açıq-aşkar dəlil və sübutlarla onlara gəlib, onları haqq tərəfinə dəvət edəndə deyərdilər: "Bəs, özümüz kimi bir insan bizə hidayət edəcəkdir?**

**(فَكَفَرُوا وَتَوَلَّوْا وَاسْتَغْنَى اللّٰهُۜ وَاللّٰهُ غَنِيٌّ حَمِيدٌ) Peyğəmbərlərə kafir olub, üz döndərdilər. Allah-Təala onları imana zorlamadığından, onların imanlarına da möhtac olmaması məlum oldu. Allah-Təala insanlara möhtac olmayıb, hər bir hərəkəti də bəyənilmişdir.**

**7) (زَعَمَ الَّذِينَ كَفَرُوٓا اَنْ لَنْ يُبْعَثُواۜ قُلْ بَلٰى وَرَبِّي لَتُبْعَثُنَّ ثُمَّ لَتُنَبَّؤُنَّ بِمَا عَمِلْتُمْۜ وَذٰلِكَ عَلَى اللّٰهِ يَسِيرٌ)** - (Ey Məhəmməd), **kafir və müşriklər elə güman edirlər ki, yenidən həyata gəlməyib, qiyamət günündə dirildilməyəcəklər. Onlara de ki, and olsun mənim rəbbim Allah-Təalaya, əlbəttə həyata gəlib, dirildiləcəksiniz. Məhşərdə bir yerə yığılandan sonra dünyada etdiyiniz əməllər sizə xəbər verilib, cəzasını görəcəksiniz. Sizə həyat verib diriltmək Allah-Təalaya asandır və heç bir şey ona mane ola bilməz.**

**8) (فَاٰمِنُوا بِاللّٰهِ وَرَسُولِهِ وَالنُّورِ الَّذِيٓ اَنْزَلْنَاۜ) Allah-Təalaya və onun peyğəmbəri** (Məhəmmədə) **və ona nazil etdiyimiz nura** (Qurana) **iman edin.**

**(وَاللّٰهُ بِمَا تَعْمَلُونَ خَبِيرٌ) Allah-Təala hər bir əməlinizə agah və xəbərdardır.**

**9) (يَوْمَ يَجْمَعُكُمْ لِيَوْمِ الْجَمْعِ ذٰلِكَ يَوْمُ التَّغَابُنِۜ) - Əvvəlkilərin və sonra gələnlərin bir yerə yığıldığı gündə** (qiyamət günündə) **Allah-Təala siz insanları haqq-hesabdan ötrü bir yerə cəm edər. O gün asilərin aldandığı gündür. Hər bir xeyirdən ümidləri kəsilib, əzaba qəti inanarlar.**

**(وَمَنْ يُؤْمِنْ بِاللّٰهِ وَيَعْمَلْ صَالِحًا يُكَفِّرْ عَنْهُ سَيِّاٰتِهِ وَيُدْخِلْهُ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَآ اَبَدًاۜ ذٰلِكَ الْفَوْزُ الْعَظِيمُ) Kim ki, Allah-Təalaya iman edib, xeyir əməl etsə, Allah-**

وَالَّذٖينَ كَفَرُوا وَكَذَّبُوا بِاٰيَاتِنَٓا اُولٰٓئِكَ اَصْحَابُ النَّارِ خَالِدٖينَ فٖيهَاۜ وَبِئْسَ الْمَصٖيرُ ﴿١٠﴾ مَٓا اَصَابَ مِنْ مُصٖيبَةٍ اِلَّا بِاِذْنِ اللّٰهِۜ وَمَنْ يُؤْمِنْ بِاللّٰهِ يَهْدِ قَلْبَهُۜ وَاللّٰهُ بِكُلِّ شَيْءٍ عَلٖيمٌ ﴿١١﴾ وَاَطٖيعُوا اللّٰهَ وَاَطٖيعُوا الرَّسُولَۚ فَاِنْ تَوَلَّيْتُمْ فَاِنَّمَا عَلٰى رَسُولِنَا الْبَلَاغُ الْمُبٖينُ ﴿١٢﴾ اَللّٰهُ لَٓا اِلٰهَ اِلَّا هُوَۜ وَعَلَى اللّٰهِ فَلْيَتَوَكَّلِ الْمُؤْمِنُونَ ﴿١٣﴾ يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوٓا اِنَّ مِنْ اَزْوَاجِكُمْ وَاَوْلَادِكُمْ عَدُوًّا لَكُمْ فَاحْذَرُوهُمْۚ وَاِنْ تَعْفُوا وَتَصْفَحُوا وَتَغْفِرُوا فَاِنَّ اللّٰهَ غَفُورٌ رَحٖيمٌ ﴿١٤﴾ اِنَّمَٓا اَمْوَالُكُمْ وَاَوْلَادُكُمْ فِتْنَةٌۜ وَاللّٰهُ عِنْدَهُٓ اَجْرٌ عَظٖيمٌ ﴿١٥﴾

---

**Təalla o şəxsin kiçik günahlarını bağışlayıb, ağaclarının və qəsrlərinin altından çaylar axan cənnətlərə daxil edər, o cənnətlərdə həmişəlik qalacaqlar. Böyük əcr və savaba yetişmək budur.**

**10) (وَالَّذٖينَ كَفَرُوا وَكَذَّبُوا بِاٰيَاتِنَٓا اُولٰٓئِكَ اَصْحَابُ النَّارِ خَالِدٖينَ فٖيهَاۜ وَبِئْسَ الْمَصٖيرُ) - Və o şəxslər ki, kafir olub, bizim ayələrimizi təkzib edirlər, onlar cəhənnəm əhlidir, orada əbədi qalacaqlar və cəhənnəm nə pis dönüləcək bir yerdir.**

**11) (مَٓا اَصَابَ مِنْ مُصٖيبَةٍ اِلَّا بِاِذْنِ اللّٰهِۜ) Allah-Təalanın təqdiri və iradəsi olmasa, dünyada heç kimə bir müsibət üz verməz, (وَمَنْ يُؤْمِنْ بِاللّٰهِ يَهْدِ قَلْبَهُۜ وَاللّٰهُ بِكُلِّ شَيْءٍ عَلٖيمٌ) və kim ki, Allah-Təalaya iman etmiş olsa, müsibət məqamında onun qəlbi hidayət tapar, ta ki, işini Allah-Təalaya həvalə edib, bilər ki, ondan ötrü təqdir olunub, ona gələn müsibət ondan yan keçməz. Başqaları üçün təqdir olunan müsibət də ona gəlməz. Müsibətin gəlib, gəlməməsi Allah-Təalanın təqdiri ilədir və Allah-Təala hər bir şeyə agahdır.**

**12) (وَاَطٖيعُوا اللّٰهَ وَاَطٖيعُوا الرَّسُولَۚ) Allah-Təalaya və onun peyğəmbərinə** (Məhəmmədə) **itaət edin. (فَاِنْ تَوَلَّيْتُمْ فَاِنَّمَا عَلٰى رَسُولِنَا الْبَلَاغُ الْمُبٖينُ) - Əgər üz döndərib, Allah-Təala və onun peyğəmbərinə itaət etməsəz, həqiqətən, bizim peyğəmbərimizə** (Məhəmmədə) **sizə hər bir hökmü açıq-aşkar yetirməkdən başqa bir şey lazım deyildir. Hər bir işiniz Allah-Təalaya həvalə edilmişdir.**

**13) (اَللّٰهُ لَٓا اِلٰهَ اِلَّا هُوَۜ وَعَلَى اللّٰهِ فَلْيَتَوَكَّلِ الْمُؤْمِنُونَ) Allah-Təaladan başqa haqq və ibadətə layiq məbud yoxdur. Gərək möminlər hər bir işlərində Allah-Təalaya təvəkkül etsinlər.**

**14) (يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوٓا اِنَّ مِنْ اَزْوَاجِكُمْ وَاَوْلَادِكُمْ عَدُوًّا لَكُمْ فَاحْذَرُوهُمْۚ) Ey möminlər, xanımlarınızdan və övladlarınızdan sizə düşmən olanlar vardır ki, onlardan sizin dininizə zərər gəlir. Onlara etimad etməyib, onların şərindən qorxun. (وَاِنْ تَعْفُوا وَتَصْفَحُوا وَتَغْفِرُوا فَاِنَّ اللّٰهَ غَفُورٌ رَحٖيمٌ) Lakin onların şərlərinin müqabilində əgər onlara əzab etməyib, bağışlasanız, həqiqətən, Allah-Təala sizə də rəhm edib, günahlarınızı bağışlayandır.**

**15) (اِنَّمَٓا اَمْوَالُكُمْ وَاَوْلَادُكُمْ فِتْنَةٌۜ وَاللّٰهُ عِنْدَهُٓ اَجْرٌ عَظٖيمٌ) Həqiqətən, sizin mal və övladınız sizdən ötrü bəla və dərddir. Onların səbəbinə günaha düşməyin. Bö-**

فَاتَّقُوا اللّٰهَ مَا اسْتَطَعْتُمْ وَاسْمَعُوا وَاَطِيعُوا وَاَنْفِقُوا خَيْرًا لِاَنْفُسِكُمْۜ وَمَنْ يُوقَ شُحَّ نَفْسِهٖ فَاُو۬لٰٓئِكَ هُمُ
الْمُفْلِحُونَ ﴿١٦﴾ اِنْ تُقْرِضُوا اللّٰهَ قَرْضًا حَسَنًا يُضَاعِفْهُ لَكُمْ وَيَغْفِرْ لَكُمْۜ وَاللّٰهُ شَكُورٌ حَلِيمٌۙ ﴿١٧﴾
عَالِمُ الْغَيْبِ وَالشَّهَادَةِ الْعَزِيزُ الْحَكِيمُ﴿١٨﴾

---

**yük əcr** (axirət əcri) **Allah-Təalanın yanındadır. Günah edib, axirət əcrini əldən verməyin.**

**16) (فَاتَّقُوا اللّٰهَ مَا اسْتَطَعْتُمْ) Gücünüz çatan qədər Allah-Təaladan çəkinib, onun əmr və qadağalarına müxalifət etməyin.**

**(وَاسْمَعُوا وَاَطِيعُوا وَاَنْفِقُوا خَيْرًا لِاَنْفُسِكُمْ) Allah-Təalanın öyüd-nəsihətlərini eşidib, əmr və qadağalarına itaət edin. Sizin olan mal-dövlətdən xeyir işdə xərcləyib, yaxşılıq edin. Nəfsinizdən ötrü xeyir əməllərə yönəlin.**

**(وَمَنْ يُوقَ شُحَّ نَفْسِهٖ فَاُو۬لٰٓئِكَ هُمُ الْمُفْلِحُونَ) Kim ki, nəfsinin xəsisliyinə mane olub, mal-dövlətindən xərcləsə, müsəlman qardaşlarının ehtiyacını həll etsə, onlar axirətdə Allah-Təalanın əzabından nicat tapan şəxslərdir.**

**17) (اِنْ تُقْرِضُوا اللّٰهَ قَرْضًا حَسَنًا يُضَاعِفْهُ لَكُمْ وَيَغْفِرْ لَكُمْۜ) - Əgər xərcləyib, Allah-Təalaya gözəl borc versəniz, o borcun əvəzini Allah-Təala sizdən ötrü artırıb, əlavə günahlarınızı da bağışlayar. (وَاللّٰهُ شَكُورٌ حَلِيمٌۙ) Allah-Təala az xeyir əmələ çox mükafat verib, günahkara əzab etməkdə tələsən deyil.**

**18) (عَالِمُ الْغَيْبِ وَالشَّهَادَةِ الْعَزِيزُ الْحَكِيمُ) Allah-Təala qeybə və aşkar olana agah olub, məxluqata qalib və onların hər bir işlərini hikmət üzrə təqdir edəndir.**

Allaha həmd olsun, Təğabün surəsinin təfsiri tamamlandı, Allahın Rəsulu buyurdu: “Kim Təğabün surəsini oxusa, ani ölümdən amanda olar.

## ət-TALAQ SURƏSİ

65-ci surədir. Mədinədə nazil olub, 12 ayə, 249 kəlmə və 1060 hərfdir.

يَٓا اَيُّهَا النَّبِيُّ اِذَا طَلَّقْتُمُ النِّسَٓاءَ فَطَلِّقُوهُنَّ لِعِدَّتِهِنَّ وَاَحْصُوا الْعِدَّةَۚ وَاتَّقُوا اللّٰهَ رَبَّكُمْۚ لَا تُخْرِجُوهُنَّ
مِنْ بُيُوتِهِنَّ وَلَا يَخْرُجْنَ اِلَّٓا اَنْ يَأْتِينَ بِفَاحِشَةٍ مُبَيِّنَةٍۜ وَتِلْكَ حُدُودُ اللّٰهِۜ وَمَنْ يَتَعَدَّ حُدُودَ اللّٰهِ فَقَدْ ظَلَمَ
نَفْسَهُۜ لَا تَدْر۪ي لَعَلَّ اللّٰهَ يُحْدِثُ بَعْدَ ذٰلِكَ اَمْرًا ﴿١﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (يَٓا اَيُّهَا النَّبِيُّ اِذَا طَلَّقْتُمُ النِّسَٓاءَ فَطَلِّقُوهُنَّ لِعِدَّتِهِنَّ) Allahın Rəsulu** (ə.s) **- ümmətinin rəisi və öndəri olub hər bir işdə onun rəyinə müraciət eyləyib, ondan izinsiz heç bir işə başlamamaq üçün bu mübarək surədə o cənaba müraciət edilib, lakin hökm bütün ümmətə aiddir. Buyurur: "Ey peyğəmbər, o zaman ki, qadınlarınızı boşamaq istədiniz, onları gözləmə müddətlərindən sonra, hansı ki, o vaxt içində gözləyəcəklər, sonra boşayın.** (Yəni təmizlik zamanında gərək ər xanımı ilə yaxınlıq etməsin, ondan sonra boşasın. Çünki aybaşı görənqadının gözləmə müddəti üç təmizlik müddəti olmalıdır. Bu səbəbdən Bəqərə surəsində "quru" sözündən məqsəd təmizlik halıdır, hərçənd Zəməxşəri və ondan başqaları İmam Əbu Hənifənin məzhəbinə görə "quru" sözünə aybaşı mənasını veriblər, lakin doğru mənası təmizlik halıdır). **(وَاَحْصُوا الْعِدَّةَۚ) Qadınların müddətlərini sayıb üç təmizlik müddətini gözləyin ki, onda heç bir nöqsan olmasın.**

**(وَاتَّقُوا اللّٰهَ رَبَّكُمْۚ لَا تُخْرِجُوهُنَّ مِنْ بُيُوتِهِنَّ وَلَا يَخْرُجْنَ اِلَّٓا اَنْ يَأْتِينَ بِفَاحِشَةٍ مُبَيِّنَةٍۜ) Rəbbiniz Allah-Təaladan qorxub, qadınları bu müddət içində məskun olduqları evlərindən çıxartmayın. Onlar özləri də gərək çıxmasınlar. Heç vaxt onları evlərindən çıxartmayın, ancaq onlardan şəriətə açıq-aşkar zidd olan çirkin bir əməl meydana gələrsə, o zaman onlara cəza verməkdən ötrü, ya da birdəfəlik evdən çıxartmaq caizdir. Bu hökm rici talaqa - geri dönülə bilən boşamaya məxsusdur. Rici talaqda qadının ev və məişətini təmin etmək ərinə vacibdir. Ta ki, gözləmə müddəti içində nə vaxt xanımına dönmək istəsə, dönsün. (وَتِلْكَ حُدُودُ اللّٰهِۜ وَمَنْ يَتَعَدَّ حُدُودَ اللّٰهِ فَقَدْ ظَلَمَ نَفْسَهُ) - Bu qeyd olunan hökmlər Allah-Təalanın təyin etdiyi hədlərdir. Kim ki, Allah-Təalanın hədlərini aşıb, müxalifət etsə, həqiqətən, o şəxs öz nəfsinə zülm edib, özünü əzaba salıbdır. (لَا تَدْر۪ي لَعَلَّ اللّٰهَ يُحْدِثُ بَعْدَ ذٰلِكَ اَمْرًا) -** (Ey Məhəmməd), **sən bilmirsən, boşandıqdan sonra nə olacaqdır. Ümidvar ol, bəlkə də Allah-Təala boşanmadan sonra başqa bir iş yaradacaqdır.** (Ərin qəlbinə xanımının məhəbbətini salıb, ona geri döndərəcəkdir).

فَاِذَا بَلَغْنَ اَجَلَهُنَّ فَاَمْسِكُوهُنَّ بِمَعْرُوفٍ اَوْ فَارِقُوهُنَّ بِمَعْرُوفٍ وَاَشْهِدُوا ذَوَيْ عَدْلٍ مِنْكُمْ وَاَقِيمُوا
الشَّهَادَةَ لِلّٰهِ ۜ ذٰلِكُمْ يُوعَظُ بِهٖ مَنْ كَانَ يُؤْمِنُ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ ۜ وَمَنْ يَتَّقِ اللّٰهَ يَجْعَلْ لَهُ مَخْرَجًاۙ ﴿٢﴾
وَيَرْزُقْهُ مِنْ حَيْثُ لَا يَحْتَسِبُ ۜ وَمَنْ يَتَوَكَّلْ عَلَى اللّٰهِ فَهُوَ حَسْبُهُ ۜ اِنَّ اللّٰهَ بَالِغُ اَمْرِهٖ ۜ قَدْ جَعَلَ اللّٰهُ لِكُلِّ
شَيْءٍ قَدْرًا ﴿٣﴾ وَالّٰئِي يَئِسْنَ مِنَ الْمَحِيضِ مِنْ نِسَآئِكُمْ اِنِ ارْتَبْتُمْ فَعِدَّتُهُنَّ ثَلٰثَةُ اَشْهُرٍۙ وَالّٰئِي لَمْ
يَحِضْنَ ۜ وَاُولَاتُ الْاَحْمَالِ اَجَلُهُنَّ اَنْ يَضَعْنَ حَمْلَهُنَّ

---

**2-3)** (فَاِذَا بَلَغْنَ اَجَلَهُنَّ فَاَمْسِكُوهُنَّ بِمَعْرُوفٍ اَوْ فَارِقُوهُنَّ بِمَعْرُوفٍ) **- O zaman ki, qadınlar gözləmə müddətlərinin sonuna yaxınlaşdılar, o vaxt ya onlara dönüb, yaxşı şəkildə onları saxlayın və ya dönməyib, yaxşı şəkildə onlardan ayrılın. Belə ki, gözləmə müddətləri bitib, öz ixtiyarlarında olsunlar.** (وَاَشْهِدُوا ذَوَيْ عَدْلٍ مِنْكُمْ) **Siz müsəlmanlardan boşanmağa, ya da qadına dönməyə iki nəfər adil şahid tutun,** (وَاَقِيمُوا الشَّهَادَةَ لِلّٰهِ) **siz şahidlər də** (boşanmağa, ya da geri dönməyə) **şəhadəti Allah-Təala üçün edib, gizləməyin.**

(ذٰلِكُمْ يُوعَظُ بِهٖ مَنْ كَانَ يُؤْمِنُ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ) **Sizin bu şəhadəti haqq və ədalətlə yerinə yetirmənizi Allah-Təala əmr etməklə axirət gününə iman edənlərə nəsihət edir, gərək Allah-Təalanın nəsihətini qəbul edib haqdan ayrılmasınlar.** (وَمَنْ يَتَّقِ اللّٰهَ يَجْعَلْ لَهُ مَخْرَجًاۙ وَيَرْزُقْهُ مِنْ حَيْثُ لَا يَحْتَسِبُ) **Kim ki, Allah-Təaladan qorxub, qadını haqqı ilə boşasa və gözləmə müddəti içində evindən çıxartmayıb, ona zərər verməsə, Allah-Təala onu qadınlar haqqında qəm-qüssəyə düşüb sıxılmaqdan xilas edər və güman etmədiyi yerdən ona ruzi verər.** (وَمَنْ يَتَوَكَّلْ عَلَى اللّٰهِ فَهُوَ حَسْبُهُ) **- Və kim ki, dünya və axirət işlərində Allah-Təalaya təvəkkül etsə, Allah-Təala tək özü onun hər bir işinə kifayət edər. Başqa birindən kömək istəmək ona lazım deyildir.**

(اِنَّ اللّٰهَ بَالِغُ اَمْرِهٖ ۜ قَدْ جَعَلَ اللّٰهُ لِكُلِّ شَيْءٍ قَدْرًا) **Həqiqətən, Allah-Təala özünün əmr və istəyini yerinə yetirib, heç bir şey onun qüdrətindən kənar olmayıb, iradəsindən çıxa bilməz. Həqiqətən, Allah-Təala hər bir şeydən ötrü təqdir edilmiş bir vaxt təyin edibdir. O şey həmin vaxtda vaqe olacaqdır. Bu səbəbdən hər bir şəxs gərək Allah-Təalaya təvəkkül edib, hər bir işini onun iradəsinə həvalə etməlidir.**

**4)** (وَالّٰئِي يَئِسْنَ مِنَ الْمَحِيضِ مِنْ نِسَآئِكُمْ اِنِ ارْتَبْتُمْ فَعِدَّتُهُنَّ ثَلٰثَةُ اَشْهُرٍۙ وَالّٰئِي لَمْ يَحِضْنَ) **Sizin qadınlarınızdan o qadınlar ki, aybaşından ümidləri üzülüb, aybaşıları kəsilib, əgər onların haqqında şəkkdə olub bilməsəniz ki, onların aybaşıları niyə kəsilib, bir də o qadınlar ki, hələ aybaşı görməyə uyğun olmayıb, aybaşı görməyiblər,** (bu iki sinif qadınları boşarkən) **gözləmə müddətləri üç aydır. Gərək üç ay gözləmə müddətinə riayət etsinlər.** (وَاُولَاتُ الْاَحْمَالِ اَجَلُهُنَّ اَنْ يَضَعْنَ حَمْلَهُنَّ) **Hamilə qadınları boşayarkən, gözləmə müddətləri doğana qədərdir. Elə ki, doğdular, gözləmə müddətləri də bitər.**

وَمَنْ يَتَّقِ اللّٰهَ يَجْعَلْ لَهُ مِنْ اَمْرِهٖ يُسْرًا ﴿٤﴾ ذٰلِكَ اَمْرُ اللّٰهِ اَنْزَلَهُ اِلَيْكُمْۜ وَمَنْ يَتَّقِ اللّٰهَ يُكَفِّرْ عَنْهُ سَيِّـَٔاتِهٖ
وَيُعْظِمْ لَهُ اَجْرًا ﴿٥﴾ اَسْكِنُوهُنَّ مِنْ حَيْثُ سَكَنْتُمْ مِنْ وُجْدِكُمْ وَلَا تُضَٓارُّوهُنَّ لِتُضَيِّقُوا عَلَيْهِنَّۜ
وَاِنْ كُنَّ اُولَاتِ حَمْلٍ فَاَنْفِقُوا عَلَيْهِنَّ حَتّٰى يَضَعْنَ حَمْلَهُنَّۚ فَاِنْ اَرْضَعْنَ لَكُمْ فَاٰتُوهُنَّ اُجُورَهُنَّۚ
وَاْتَمِرُوا بَيْنَكُمْ بِمَعْرُوفٍۚ

---

(Əgər boşandıqdan sonra bir müddət keçib, doğsalar, gözləmə müddətləri də qurtarar). **(وَمَنْ يَتَّقِ اللّٰهَ يَجْعَلْ لَهُ مِنْ اَمْرِهٖ يُسْرًا) - Və kim ki, Allah-Təaladan qorxur, ondan ötrü Allah-Təala dünya və axirət işini asan edib, çətinliklərini həll edər.**

**5) (ذٰلِكَ اَمْرُ اللّٰهِ اَنْزَلَهُ اِلَيْكُمْۜ) Qadınların boşanmaq vaxtında gözləmə müddətləri barəsində qeyd olunan bu hökmlər Allah-Təalanın əmridir. Sizə nazil edibdir. (وَمَنْ يَتَّقِ اللّٰهَ يُكَفِّرْ عَنْهُ سَيِّـَٔاتِهٖ وَيُعْظِمْ لَهُ اَجْرًا) - Və kim ki, Allah-Təaladan qorxub, bu qeyd olunan ehkama əməl etsə, Allah-Təala onun kiçik günahlarını bağışlayıb, ondan ötrü axirətdə əcr və savabını böyük edər. Bu gözləmə müddətlərinin hamısı boşanma müddətidir, bir şərtlə ki, ər xanımına yaxınlaşmamış olsun. Amma əgər xanımına yaxınlaşmadan boşasa, ya da ki, xanım aybaşıdan kəsilib, yaşı da əllini keçmiş olsa** (hansı ki, aybaşının kəsilmə vaxtıdır), **belə halda boşasa, bunlara gözləmə müddəti lazım deyildir. Amma əri vəfat edənin gözləmə müddəti belədir: "Qadın aybaşı görən olsun, ya olmasın, əri ona yaxınlaşsın, ya yaxınlaşmasın, kiçik olsun, ya böyük olsun, fərqi yoxdur, ər vəfat edərsə, xanımı gərək dörd ay on gün gözləsin. Necə ki, Bəqərə surəsində bəyan olundu.**

**6-7) (اَسْكِنُوهُنَّ مِنْ حَيْثُ سَكَنْتُمْ مِنْ وُجْدِكُمْ) - Boşadığınız qadınları gözləmə müddətləri içində gücünüz çatan qədər öz yaşadığınız evdə məskun etdirin. (وَلَا تُضَٓارُّوهُنَّ لِتُضَيِّقُوا عَلَيْهِنَّ) Sıxışdırıb, evdən çıxarmaq üçün qadınlara zərər verməyib, əziyyət etmək fikrində olmayın.**

**(وَاِنْ كُنَّ اُولَاتِ حَمْلٍ فَاَنْفِقُوا عَلَيْهِنَّ حَتّٰى يَضَعْنَ حَمْلَهُنَّۚ) - Əgər bu boşanmış qadınlar hamilə olsalar, gərək onlar doğana qədər xərclərini verəsiniz.**

**(فَاِنْ اَرْضَعْنَ لَكُمْ فَاٰتُوهُنَّ اُجُورَهُنَّۚ) - Əgər bu boşanmış qadınlar sizin uşaqlarınıza süd versələr, onların haqqlarını verin, bunsuz süd vermək onlara vacib deyildir. (وَاْتَمِرُوا بَيْنَكُمْ بِمَعْرُوفٍۚ) Siz atalar və analar uşaq barəsində öz aranızda bir-birinizlə yaxşı şəkildə anlaşıb, bir-birinizin sözünü qəbul edin.** (Məsələn, ata uşağının anasına deyəndə ki, hərçənd səni boşamışam, lakin bu uşaq mənim övladım olduğu kimi sənin də övladındır, mənim imkanıma görə məndən haqq istə. Gərək ana bunu qəbul etsin. Habelə ana uşağın atasına deyəndə ki, bu, sənin uşağındır, məni də bir dayə hesab edib, adət üzrə mənim də xərcimi ver, əgər bir qədər çox da versən, uşağına görə sənə bir zərər gəlməz. Gərək ata bunu qəbul edib güzəşt etsin).

وَاِنْ تَعَاسَرْتُمْ فَسَتُرْضِعُ لَهُ اُخْرٰىؕ ﴿٦﴾ لِيُنْفِقْ ذُو سَعَةٍ مِنْ سَعَتِهٖؕ وَمَنْ قُدِرَ عَلَيْهِ رِزْقُهُ فَلْيُنْفِقْ مِمَّآ
اٰتٰيهُ اللّٰهُؕ لَا يُكَلِّفُ اللّٰهُ نَفْسًا اِلَّا مَآ اٰتٰيهَاؕ سَيَجْعَلُ اللّٰهُ بَعْدَ عُسْرٍ يُسْرًاۙ ﴿٧﴾ وَكَاَيِّنْ مِنْ قَرْيَةٍ عَتَتْ
عَنْ اَمْرِ رَبِّهَا وَرُسُلِهٖ فَحَاسَبْنَاهَا حِسَابًا شَدِيدًا وَعَذَّبْنَاهَا عَذَابًا نُكْرًا ﴿٨﴾ فَذَاقَتْ وَبَالَ اَمْرِهَا وَكَانَ
عَاقِبَةُ اَمْرِهَا خُسْرًا ﴿٩﴾ اَعَدَّ اللّٰهُ لَهُمْ عَذَابًا شَدِيدًا فَاتَّقُوا اللّٰهَ يَآ اُولِي الْاَلْبَابِۚ اَلَّذِينَ اٰمَنُواۚ قَدْ
اَنْزَلَ اللّٰهُ اِلَيْكُمْ ذِكْرًاۙ ﴿١٠﴾ رَسُولًا

---

(وَاِنْ تَعَاسَرْتُمْ فَسَتُرْضِعُ لَهُ اُخْرٰىؕ) - **Əgər siz ata-analar (talaq səbəbinə) - Bir-birinizi övlad haqqında sıxışdırsanız,** (ana istəyən haqqı ata verməyib, ana da pulsuz süd verməsə), **lakin analar gərək uşağı düşünüb, az bir zəhmət haqqına razı olub, uşağı özgə dayəyə verməyə gərək razı olmasınlar. Əgər analar uşaqlarını düşünməyib, onlara mərhəmət etməsələr, o vaxt başqa dayə qəhət deyil, ata başqa dayə tapıb, dayə uşağa süd verəcəkdir. Amma ana gərək özü uşağa süd verib, özgə dayəyə verməyə razı olmasın.** (Anaların uşaqlarından əl çəkib, onları özgə dayələrə verməyə razı olmasına görə Allah-Təala ayədə onları məzəmmət edir). (لِيُنْفِقْ ذُو سَعَةٍ مِنْ سَعَتِهٖؕ) **Atalar da gərək uşağını düşünüb, anayı boşaması səbəbi ilə gərək uşağına zərər verməsin, imkanı bol olan şəxs gərək öz halına münasib olaraq uşağın anasına zəhmət haqqı versin. Ta ki, uşağa öz anası süd verib, başqa qadının süd verməsinə razı olmasın.** (وَمَنْ قُدِرَ عَلَيْهِ رِزْقُهُ فَلْيُنْفِقْ مِمَّآ اٰتٰيهُ اللّٰهُؕ) - **Və kim ki, ruzisi az olub, yoxsul olsa, belə şəxsə varlılara olan təklif olunmayıb, Allah-Təalanın ona verdiyi ruzidən gücü çatan qədər xərcləsin ki, ana uşağını bəsləyə bilsin.** (لَا يُكَلِّفُ اللّٰهُ نَفْسًا اِلَّا مَآ اٰتٰيهَاؕ) **Uşaqlardan ötrü analara nəfəqə vermək barəsində Allah-Təala** (zəngin və ya kasıb) **heç kimi verdiyindən artıq məsul etməz.** (Zəngin və kasıbı öz halına uyğun məsul edər). (سَيَجْعَلُ اللّٰهُ بَعْدَ عُسْرٍ يُسْرًاۙ) **Yoxsullar gərək səbir edib, ümidvar olsunlar ki, Allah-Təala onlardan ötrü kasıblıqdan sonra zənginlik, darlıqdan sonra bolluq verib, ruzi qapısını onların üzünə açar.**

**8)** (وَكَاَيِّنْ مِنْ قَرْيَةٍ عَتَتْ عَنْ اَمْرِ رَبِّهَا وَرُسُلِهٖ فَحَاسَبْنَاهَا حِسَابًا شَدِيدًا وَعَذَّبْنَاهَا عَذَابًا نُكْرًا) - (Ey Məhəmməd), **çox şəhərlərin əhli öz rəbləri Allah-Təalanın və onun peyğəmbərlərinin əmr və itaətindən üz döndərib, asi oldular. Ölüm onlara gələndən sonra biz də onlarla şiddətli haqq-hesab çəkib, son dərəcə diksindikləri bir əzab verdik.**

**9)** (فَذَاقَتْ وَبَالَ اَمْرِهَا وَكَانَ عَاقِبَةُ اَمْرِهَا خُسْرًا) **Asi nəfslər öz əməllərinin cəzasını dadıb, işlərinin sonu axirətdə ziyan oldu.**

**10-11)** (اَعَدَّ اللّٰهُ لَهُمْ عَذَابًا شَدِيدًا فَاتَّقُوا اللّٰهَ يَآ اُولِي الْاَلْبَابِ) **Allah-Təala asilərdən ötrü şiddətli əzab hazır edibdir. Ey ağıl sahibləri, Allah-Təaladan qorxub, asi olmayın ki, sizə də elə əzab etməsin.**

(اَلَّذِينَ اٰمَنُواۚ قَدْ اَنْزَلَ اللّٰهُ اِلَيْكُمْ ذِكْرًاۙ رَسُولًاۚ) **Ağıl sahibləri Allah-Təalaya iman**

يَتْلُوا عَلَيْكُمْ اٰيَاتِ اللّٰهِ مُبَيِّنَاتٍ لِيُخْرِجَ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ مِنَ الظُّلُمَاتِ اِلَى النُّورِ وَمَنْ
يُؤْمِنْ بِاللّٰهِ وَيَعْمَلْ صَالِحًا يُدْخِلْهُ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَآ اَبَدًا قَدْ اَحْسَنَ اللّٰهُ
لَهُ رِزْقًا﴿١١﴾ اَللّٰهُ الَّذِي خَلَقَ سَبْعَ سَمٰوَاتٍ وَمِنَ الْاَرْضِ مِثْلَهُنَّ يَتَنَزَّلُ الْاَمْرُ بَيْنَهُنَّ لِتَعْلَمُوٓا اَنَّ اللّٰهَ
عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ وَاَنَّ اللّٰهَ قَدْ اَحَاطَ بِكُلِّ شَيْءٍ عِلْمًا﴿١٢﴾

---

**edib, müvəhhid olan şəxslərdir. Həqiqətən, Allah-Təala rəhmətini sizə şamil edib, Quran və peyğəmbər göndərdi.**

(يَتْلُوا عَلَيْكُمْ اٰيَاتِ اللّٰهِ مُبَيِّنَاتٍ لِيُخْرِجَ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ مِنَ الظُّلُمَاتِ اِلَى النُّورِ) **Peyğəmbər sizə Allah-Təalanın halal-haramı bəyan edən ayələrini oxuyur ki, iman edib, xeyir əməl edən şəxsləri küfr və cəhalət qaranlığından iman və elm nuruna tərəf çıxarıb, haqqa vasil etsin.**

(وَمَنْ يُؤْمِنْ بِاللّٰهِ وَيَعْمَلْ صَالِحًا يُدْخِلْهُ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَآ اَبَدًا قَدْ اَحْسَنَ اللّٰهُ لَهُ رِزْقًا) - **Və kim ki, Allah-Təalaya iman edib, xeyir əməl etsə, Allah-Təala elə şəxsi ağaclarının və qəsrlərinin altından çaylar axan cənnətlərə daxil edər və o cənnətlərdə həmişəlik qalacaqlar. Həqiqətən, belə şəxsdən ötrü Allah-Təala gözəl ruzi təyin edibdir.**

**12)** (اَللّٰهُ الَّذِي خَلَقَ سَبْعَ سَمٰوَاتٍ وَمِنَ الْاَرْضِ مِثْلَهُنَّ) **Allah-Təala öz kamil qüdrəti ilə yeddi* səmanı və yerdən də bir o qədərini yaratdı.**

(يَتَنَزَّلُ الْاَمْرُ بَيْنَهُنَّ لِتَعْلَمُوٓا اَنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ) **Allah-Təalanın əmr və iradəsi göylərin və yerin arasında olan məxluqata şamil olub, heç bir şey onun qüdrət və iradəsindən çıxa bilməz. Allah-Təala göyləri və yeri yaratdı ki, siz agah olasınız ki, həqiqətən, Allah-Təala hər bir şeyə qadirdir.**

(وَاَنَّ اللّٰهَ قَدْ اَحَاطَ بِكُلِّ شَيْءٍ عِلْمًا) - **Və yenə agah olasınız ki, həqiqətən, Allah-Təala elmi ilə hər bir şeyi əhatə edib, heç bir fərd, əşya onun elmindən kənar ola bilməz.**

**(*Qeyd:** *"Ola bilər ki, yeddi səma havanın sərtliyindən və yumşaqlığından, yeddi yer də maddələrdən ibarət olsun. Ya da ki, yer yeddi ulduzun hər biri üçün ayrı səma sayılsın. Doğrusunu Allah bilir).*

**Allaha həmd olsun. Talaq surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: "Kim Talaq surəsini oxuyarkən vəfat etsə, mənim yolumda vəfat etmiş sayılar.**

## ət-TƏHRİM SURƏSİ

66-cı surədir. Mədinədə nazil olub, 12 ayə, 247 kəlmə və 1060 hərfdir.

يَٓا اَيُّهَا النَّبِيُّ لِمَ تُحَرِّمُ مَٓا اَحَلَّ اللّٰهُ لَكَۚ تَبْتَغٖي مَرْضَاتَ اَزْوَاجِكَۜ وَاللّٰهُ غَفُورٌ رَحٖيمٌ ﴿١﴾

**Bismillahir-Rəhmanir-Rəhim**

Təfsir alimləri bu surənin nazil olmasının səbəbini belə izah ediblər: “Allahın Rəsulu (ə.s) xanımlarının arasında növbə bölgüsü aparıb, boş vaxtlarında hər gün birinin mənzilinə təşrif apardı. Bir gün Həfsə Ömər ibn Xəttab qızının növbəsi idi. Həfsə peyğəmbərdən izin alıb atasının evinə getdi. O günü də peyğəmbər Misir hakimi Muqavqisin göndərdiyi kənizi qibti Mariya ilə keçirtdi. Həfsə qayıdıb bu məsələdən xəbərdar oldu. Qeyzindən ağladı. Dedi: “Ey peyğəmbər, niyə mənim növbə günümdə Mariyanın yanına getdin? Buyurdu: “Bəs Mariya mənim kənizim deyildirmi? Həfsə dedi: “Bəli, belədir. Buyurdu: “Sən bu məsələni unut, mən onunla bir də görüşməkdən imtina edirəm, bir də onunla bir yerdə olmaram - deyərək and içdi.

Ondan sonra Həfsənın şad olmağından ötrü buyurdu: “Sənə yaxşı bir xəbər verim. Məndən sonra sənin atan və Əbu Bəkir bu ümmətə rəhbər olacaqlar. Amma bu sirri gizlət, heç kimə bildirmə. Həfsə bu məsələyə çox sevindi. Öz mənzilinə daxil olub, onunla Aişənin mənzilinin arasında olan divarı döydü, Aişə də gəldi. Aişə və Həfsə bir-birilərinə qarşı sevgi və sədaqət içində idilər. Həfsə dedi: “Allah-Təala bizi Mariyadan qurtardı, peyğəmbər ondan birdəfəlik üz döndərdi. Hadisəni təfərrüatı ilə Aişəyə nəql edib, atalarının xəlifəlik xəbərini də ona bildirdi. Allah-Təala Həfsənın sirri ifşa etdiyini peyğəmbərə xəbər verdi. Peyğəmbər xanımlarının hamısından üz döndərib, and içdi ki, bir ay onlardan uzaq dursun. Onlardan ayrılıb, ayrı bir mənzildə yerləşdi. İyirmi doqquz gündən sonra xanımlarının evinə gəlib, əvvəlcə Aişənin mənzilinə daxil oldu. O vaxt peyğəmbər öz xanımlarına boşanmaq və ya evliliyi davam etdirmək təklifini etdi. Əvvəlki Əhzab surəsində Allah-Təala bu mövzuda ayə nazil etmişdi. Bu mətləbin təfsilatı həmin surədə qeyd olunubdur. Oraya baxılsın. Allahın Rəsulu Mariyadan üz döndərdiyi üçün Allah-Təala gələn surəni nazil edib, peyğəmbərini qınadı.

**1) (يَٓا اَيُّهَا النَّبِيُّ لِمَ تُحَرِّمُ مَٓا اَحَلَّ اللّٰهُ لَكَۚ تَبْتَغٖي مَرْضَاتَ اَزْوَاجِكَۜ وَاللّٰهُ غَفُورٌ رَحٖيمٌ) Ey peyğəmbər, nədən* ötrü Allah-Təalanın sənə halal etdiyi şeyi** (Mariyanı) **özünə haram edib, ona yaxınlaşmaqdan imtina edirsən? Digər xanımla**

قَدْ فَرَضَ اللّٰهُ لَكُمْ تَحِلَّةَ اَيْمَانِكُمْۚ وَاللّٰهُ مَوْلٰيكُمْۚ وَهُوَ الْعَلٖيمُ الْحَكٖيمُ ﴿٢﴾ وَاِذْ اَسَرَّ النَّبِيُّ اِلٰى بَعْضِ
اَزْوَاجِهٖ حَدٖيثًاۚ فَلَمَّا نَبَّاَتْ بِهٖ وَاَظْهَرَهُ اللّٰهُ عَلَيْهِ عَرَّفَ بَعْضَهُ وَاَعْرَضَ عَنْ بَعْضٍۚ فَلَمَّا نَبَّاَهَا بِهٖ قَالَتْ
مَنْ اَنْبَاَكَ هٰذَاۜ قَالَ نَبَّاَنِيَ الْعَلٖيمُ الْخَبٖيرُ ﴿٣﴾

---

**rın məmnunluğunu düşünüb,** (Mariyadan) **üz döndərirsən? Belə iş sənə layiq deyildir. Gərək səndən belə əməl meydana gəlməsin.**

**(*Qeyd:** *"Quran əhli gərək bu ayəyə diqqət edib düşünsünlər ki, Allah-Təala bir kənizə görə öz möhtərəm peyğəmbərinə necə xitab edir və necə məzəmmət edir? Bəs qadınlara zülm edənlərin əhvalı necə olacaqdır? Allah-Təala qadınlara zərər verən heç bir şeyə razı deyil. Necə ola bilər ki, onlara zülm edilib, ömür boyu onlara rahatlıq verilməsin? Cahiliyyə zamanında kobud olan ərəblər qadınların hüququnu qorumayıb, onlara ehtiram etməzdilər. Onları heyvanlara bərabər sayardılar. Lakin islam zühur edəndən sonra onlardan ötrü hər bir məqamda haqq və ehtiram təsdiq olunsa da, amma müsəlmanların əksəriyyəti özlərini cahiliyyə dövrünün bədəvi ərəblərindən də betər aparıb, qadınların hüquq və imtiyazlarını tapdalayıb, Allah-Təalanın və uca peyğəmbərimizin qadınlara verdiyi dəyəri düşünməyib, zülm və haqsızlığı özlərinə şüar seçiblər).*

**2) (قَدْ فَرَضَ اللّٰهُ لَكُمْ تَحِلَّةَ اَيْمَانِكُمْۚ)** - (Ey Məhəmməd), **sizdən belə bir əməl meydana gələn zamanda həqiqətən, Allah-Təalaya kəffarə verib, andınızı pozmanızı sizdən ötrü bəyan və sizə vacib edibdir. O şəxs ki, xanımına yaxınlaşmayacağı barədə and içdi, gərək kəffarə verib, andını pozsun.** (Yəni xanımını tərk edəndən sonra and içməsin, ya da and içərsə, kəffarəsini verib onu pozsun. Allahın Rəsulu Mariya haqqında and içdiyinə görə kəffarə olaraq bir qulam azad etdi). **(وَاللّٰهُ مَوْلٰيكُمْۚ وَهُوَ الْعَلٖيمُ الْحَكٖيمُ) Sizin hər bir işinizin ilk sahibi Allah-Təaladır. Hər bir işinizə agahdır. Hikməti üzrə bəzi şeyləri əmr edib, bəzi şeyləri qadağan edər.**

**3) (وَاِذْ اَسَرَّ النَّبِيُّ اِلٰى بَعْضِ اَزْوَاجِهٖ حَدٖيثًاۚ) - O zaman ki, peyğəmbərimiz** (Məhəmməd) **xanımlarının bəzisinə** (Həfsəyə) **bir söz deyib, gizlətməsini tövsiyə etdi,** (Mariyanı özünə haram etmək və Ömərlə, Əbu Bəkrin xəlifəliyi məsələsi), **(فَلَمَّا نَبَّاَتْ بِهٖ وَاَظْهَرَهُ اللّٰهُ عَلَيْهِ عَرَّفَ بَعْضَهُ وَاَعْرَضَ عَنْ بَعْضٍ) - O zaman ki, Həfsə peyğəmbərin sözünü Aişəyə xəbər verdi, Allah-Təala peyğəmbərini agah etdi ki, Həfsə sənin sözünü Aişəyə xəbər veribdir. Allahın Rəsulu o sözün bəzisini** (Mariyanı özünə haram etməsini) **Həfsəyə bildirib, bəzisini** (Ömərlə Əbu Bəkrin xəlifəliyini) **bildirmədi.** (Xalqın arasında yayılmasın deyə). **(فَلَمَّا نَبَّاَهَا بِهٖ قَالَتْ مَنْ اَنْبَاَكَ هٰذَاۜ قَالَ نَبَّاَنِيَ الْعَلٖيمُ الْخَبٖيرُ) Elə ki, peyğəmbər** (Həfsənin Aişəyə) **sirri ifşa etməsini ona xəbər verdi,** (Həfsə) **dedi: "Bu xəbəri sənə kim verdi? Allahın Rəsulu buyurdu: "Hər bir şeyə agah və xəbərdar olan Allah-Təala mənə xəbər verdi.**

إِنْ تَتُوبَآ إِلَى اللّٰهِ فَقَدْ صَغَتْ قُلُوبُكُمَاۚ وَإِنْ تَظَاهَرَا عَلَيْهِ فَإِنَّ اللّٰهَ هُوَ مَوْلٰيهُ وَجِبْرِيلُ وَصَالِحُ الْمُؤْمِنِينَۚ
وَالْمَلٰئِكَةُ بَعْدَ ذٰلِكَ ظَهِيرٌ ﴿٤﴾

**4)** (إِنْ تَتُوبَآ إِلَى اللّٰهِ فَقَدْ صَغَتْ قُلُوبُكُمَاۚ) (Ey* Həfsə və Aişə), **əgər peyğəmbərə verdiyiniz əziyyətə görə tövbə edib, Allah-Təalanın tərəfinə qayıtsanız** (yaxşı olar), **həqiqətən, sizin qəlbiniz haqdan** (günaha tərəf) **meyl edib, tövbə etməniz lazımdır.** (وَإِنْ تَظَاهَرَا عَلَيْهِ) **- Və əgər tövbə etməyib, bir-birinizə kömək edib, peyğəmbərə əziyyət etsəniz, sizin əziyyətinizdən ona heç bir zərər varid olmaz və bir-birinizə kömək etməniz də bir fayda verməz.** (فَإِنَّ اللّٰهَ هُوَ مَوْلٰيهُ وَجِبْرِيلُ وَصَالِحُ الْمُؤْمِنِينَۚ وَالْمَلٰئِكَةُ بَعْدَ ذٰلِكَ ظَهِيرٌ) **Həqiqətən, Allah-Təala, Cəbrayıl** (peyğəmbərliyə məxsus olan müqəddəs ruhani güc) **və saleh, xeyir əməl edən möminlərin hamısı ona köməkdir. Onlardan sonra insanı kamillik dərəcəsinə çıxarıb, düz yol olan hidayətə vasil edən mələklər də** (bütün ruhani qüvvələr) **ona köməkçidirlər.**

**(*Qeyd:** *"İbn Abbas deyir: "Ayədə məzəmmət edilən iki qadının peyğəmbərin hansı xanımları olduğunu Ömər ibn Xəttabdan soruşmağı çox istəyirdim. Ömər öz xəlifəliyi zamanında həccə gedərkən, mən də onunla birlikdə həccə getdim. Yol əsnasında Ömər ayaqyolu üçün yoldan kənara çıxdı. Mən ondan ötrü su apardım. Elə ki, işini qurtardı, dəstəmaz üçün əlinə su tökdüm. Bu əsnada fürsət tapıb soruşdum: "Ya əmirəl-möminin, o qadınlar ki, Allah-Təala ayədə onlara xitab edib, "əgər tövbə etsəniz..." buyurdu, o qadınlar peyğəmbərin hansı xanımlarıdır? Ömər bu sualdan xoşlanmayıb dedi: "Heyrət edirəm sənə, ey İbn Abbas. Ondan sonra dedi: "O iki qadın Həfsə və Aişədir. Ondan sonra Ömər əhvalatı İbn Abbasa təfsilatı ilə bəyan etməyə başlayıb dedi: "Ey İbn Abbas, (Ömər İbn Abbası çox istəyib, ona ümmətin alimi deyirdi), biz Qüreyş camaatı Məkkədə olanda qadınlarımıza üstün olub, onlar bizim qüdrətimizə tabe idilər. Elə ki hicrət edib Mədinəyə varid olduq, baxıb gördük ki, onların qadınları kişilərinə üstündür. Bizim qadınlarımız da onlardan öyrəndilər. Mədinədə mənim evim Bəni-Ümeyyə ibn Zeyd camaatının arasında, Mədinənin kənarında idi. Bir gün xanıma qəzəbləndim. O da mənə cavab qaytardı. Mən bundan daha çox qəzəbləndim. Xanım dedi: "Sənə cavab qaytardığım üçün hirslənirsən? Vallah, peyğəmbərin xanımları ona cavab qaytarıb, bəziləri bir gün axşama kimi onu tərk edib dindirmirlər. Mən bu sözü eşidən kimi qalxıb qızım Həfsənin yanına getdim, dedim: "Siz peyğəmbərə cavab qaytarırsız? Dedi: "Bəli. Dedim: "Sizlərdən belə iş görən hər bir qadın dünya və axirətdə öz nəfsinə qarşı ziyankar olubdur. Bəs o qadın peyğəmbəri qəzəbləndirdiyinə görə Allah-Təalanın ona qəzəblənməməsindən arxayındırmı? O zaman bu qadın fəlakətə düçar olar, qızım, sən peyğəmbərə cavab qaytarma. Ondan heç nə istəmə. Nə ehtiyacın olsa, məndən istə. Sənin günülərindən bəzilərinin (Aişənin) gözəl və peyğəmbər üçün sevimli olmasına aldanıb, sən də ona baxıb elə rəftar eləmə. Ömər deyir: "Ənsardan mənim bir qonşum var idi.*

*Mənzilimiz peyğəmbərin evindən uzaq olduğuna görə növbə ilə bir gün mən və bir gün o şəxs peyğəmbərin hüzuruna gedib, vəhy və digər xəbəri bir-birimizə çatdırırdıq. Mədinədə camaat arasında söz-söhbət gəzirdi ki, Qəssanilər Şamdan qoşun yığıb, bizimlə savaşmağa gələcəklər. Bir gün ənsari qonşum öz növbə günündə axşam vaxtı gəlib, mənim qapımı döyüb məni çağırdı. Çölə çıxdım. Dedi: "Böyük bir hadisə olubdur. Dedim: "Nə olub, Qəssanilər gəlib? Dedi: xeyr, ondan da böyük iş olub. Allahın Rəsulu xanımlarını boşayıb. Bu sözü eşidən kimi dedim: "Həfsə ziyankar oldu. Bu işin belə tez olacağını güman edirdim. Səbir etdim, sübh namazını qılandan sonra Həfsənın mənzilinə gedib, gördüm Həfsə ağlayır. Dedim: "Allahın Rəsulu sizi boşadımı? Həfsə dedi: "Bilmirəm, bizdən üz döndərib, öz mənzilində təkdir. Ömər deyir: "Peyğəmbərin mənzilinə tərəf gedib, onun qara qulamına dedim: Ömərdən ötrü peyğəmbərdən izin al. Qulam içəri girdi, ondan sonra çıxıb dedi: "Səndən ötrü izin istədim, peyğəmbər dinmədi. Ömər deyir: "Oradan məscidə gedib, minbərin yanında oturan camaatı gördüm, bəziləri ağlayırdı. Bir az əyləşdim. Ondan sonra qalxdım, qulamın yanına gedim. Dedim: Ömərdən ötrü izin al. Qulam içəri girdi, çıxıb təkrar dedi: "İzin istədim, peyğəmbər dinmədi. Ömər deyir: "Qayıdıb məscidə gedib, minbərin yanında əyləşdim. Sakit ola bilməyib, təkrar qulamın yanına gedib dedim: Ömərdən ötrü izin al. İçəri girib çıxandan sonra yenə dedi: "İzin istədim, peyğəmbər dinmədi. Ömər deyir: "Mən qayıtdım, qulam arxadan məni çağırdı, dedi: "Allahın Rəsulu sənə izin verdi, peyğəmbərin hüzuruna daxil ol. Ömər deyir: "İçəri daxil olub, peyğəmbərə salam verdim. Gördüm o cənab bir həsirə söykənib. Dedim: "Ey peyğəmbər, xanımlarını boşayıbsan? Başını qaldırıb dedi: xeyr. Dedim: "Allah uludur, ey peyğəmbər, biz Qüreyş camaatı xanımlarımıza hakim idik, elə ki, Mədinəyə gəldik, gördük Mədinə əhlinin xanımları ərlərinə hakimdirlər. Bizim qadınlarımız da onlardan öyrəndilər. (Ondan sonra Ömər öz xanımı ilə arasında olan söhbəti peyğəmbərə nəql etdi). Ömər deyir: "Peyğəmbər təbəssüm etdi. Ondan sonra dedim: "Ey peyğəmbər, Həfsəyə demişəm ki, Aişənin gözəl və peyğəmbərin sevimli olması səni aldatmasın. Bu zaman peyğəmbər yenə təbəssüm etdi. Dedim: "Əyləşməyə izin verirsiniz? Buyurdu: "Bəli. Əyləşdim. Evin içinə baxdım, bir şey görmədim. Dedim: "Ey peyğəmbər, Allah-Təaladan xahiş et, sənin ümmətinə də bolluq versin. Farslara və Ruma bolluq verib, halbuki onlar Allah-Təalaya ibadət etmirlər. Buyurdu: "Xəttab oğlu, məgər şəkkin var? Dedim: "Ey peyğəmbər, Allahdan mənim üçün əfv istə. Ömər deyir: "Peyğəmbər and içmişdi ki, bir ay xanımlarına yaxınlaşmasın. İyirmi doqquz gün tamam olanda xanımlarının yanına getdi. Dedilər: "Ey peyğəmbər, sən bir aylıq and içmişdin. Buyurdu: "Ay gah otuz, gah iyirmi doqquz gün olur).*

**5) (عَسٰى رَبُّهُ اِنْ طَلَّقَكُنَّ اَنْ يُبْدِلَهُ اَزْوَاجًا خَيْرًا مِنْكُنَّ) Ey peyğəmbər xanımları, əgər peyğəmbər sizi boşasa, onun rəbbi Allah-Təalaya lazımdır ki, sizin əvəzinizə sizdən də yaxşı xanımları ona qismət etsin. Hansı ki, o qadınlar**

مُسْلِمَاتٍ مُؤْمِنَاتٍ قَانِتَاتٍ تَآئِبَاتٍ عَابِدَاتٍ سَآئِحَاتٍ ثَيِّبَاتٍ وَاَبْكَارًا ﴿٥﴾ يَآ اَيُّهَا الَّذٖينَ اٰمَنُوا قُوٓا
اَنْفُسَكُمْ وَاَهْلٖيكُمْ نَارًا وَقُودُهَا النَّاسُ وَالْحِجَارَةُ عَلَيْهَا مَلٰئِكَةٌ غِلَاظٌ شِدَادٌ لَا يَعْصُونَ اللّٰهَ مَآ اَمَرَهُمْ
وَيَفْعَلُونَ مَا يُؤْمَرُونَ ﴿٦﴾ يَآ اَيُّهَا الَّذٖينَ كَفَرُوا لَا تَعْتَذِرُوا الْيَوْمَ ۜ اِنَّمَا تُجْزَوْنَ مَا كُنْتُمْ تَعْمَلُونَ
﴿٧﴾ يَآ اَيُّهَا الَّذٖينَ اٰمَنُوا تُوبُوٓا اِلَى اللّٰهِ تَوْبَةً نَصُوحًاۜ عَسٰى رَبُّكُمْ اَنْ يُكَفِّرَ عَنْكُمْ سَيِّاٰتِكُمْ وَيُدْخِلَكُمْ
جَنَّاتٍ تَجْرٖي مِنْ تَحْتِهَا الْاَنْهَارُۙ يَوْمَ لَا يُخْزِي اللّٰهُ النَّبِيَّ وَالَّذٖينَ اٰمَنُوا مَعَهُۚ نُورُهُمْ يَسْعٰى بَيْنَ
اَيْدٖيهِمْ وَبِاَيْمَانِهِمْ يَقُولُونَ رَبَّنَآ اَتْمِمْ لَنَا نُورَنَا وَاغْفِرْ لَنَاۚ اِنَّكَ عَلٰى كُلِّ شَيْءٍ قَدٖيرٌ ﴿٨﴾

---

**bundan sonra qeyd olunan sifətlərə sahib olsunlar. (مُسْلِمَاتٍ مُؤْمِنَاتٍ) Allah-Təalanın tövhidini təsdiq edib, zillət və təvazö ilə Allah-Təalaya itaət edən olarlar. (قَانِتَاتٍ) Həmişə Allah-Təalanın itaətində olub, bir an itaətdən çıxmazlar. (تَآئِبَاتٍ) Çox ibadət edərlər. (عَابِدَاتٍ سَآئِحَاتٍ) - Oruc tutan olarlar. (ثَيِّبَاتٍ وَاَبْكَارًا) Allah-Təala bu xüsusiyyətlərə sahib olan dul və bakirə qadınları peyğəmbərinə verməyə qadirdir və ondan ötrü qadın qəhət deyildir. Xanımlar, gərək, peyğəmbərə itaət edib, ona asi olmayasınız.**

**6) (يَآ اَيُّهَا الَّذٖينَ اٰمَنُوا قُوٓا اَنْفُسَكُمْ وَاَهْلٖيكُمْ نَارًا وَقُودُهَا النَّاسُ وَالْحِجَارَةُ) Ey iman edənlər, çirkin əməlləri tərk etməklə, nəfsinizə bunu nəsihət etməklə özünüzü və ailənizi yanacağı insan və** (kibrit) **daşı olan bir odun əzabından qoruyub mühafizə edin. (عَلَيْهَا مَلٰئِكَةٌ غِلَاظٌ شِدَادٌ لَا يَعْصُونَ اللّٰهَ مَآ اَمَرَهُمْ وَيَفْعَلُونَ مَا يُؤْمَرُونَ) Həmin odla əzab etməyə qəzəbli və şiddətli mələklər vəzifəlidirlər. Allah-Təalanın onlara əmr etdiyi işlərdə ona asi olmayıb, əmr olunduqları şeyi yerinə yetirərlər.**

**7) (يَآ اَيُّهَا الَّذٖينَ كَفَرُوا لَا تَعْتَذِرُوا الْيَوْمَ ۜ اِنَّمَا تُجْزَوْنَ مَا كُنْتُمْ تَعْمَلُونَ) - (Ey Məhəmməd), elə ki, qiyamət günündə kafirlər cəhənnəmə daxil edilər, o vaxt bizim tərəfimizdən onlara deyilər: "Bugünkü gündə heç bir üzrxahlıq etməyin, üzrxahlığınız qəbul olunmayıb, sizə fayda verən deyildir. Həqiqətən, sizə öz əməllərinizin cəzası verilir, belə olan halda nə üzrxahlıq edəcəksiniz?**

**8) (يَآ اَيُّهَا الَّذٖينَ اٰمَنُوا تُوبُوٓا اِلَى اللّٰهِ تَوْبَةً نَصُوحًاۜ) Ey iman edənlər, günah və çirkin əməlləri tərk etməkdə nəfsinizə nəsihət edib, elə əməllərə qurşanmağa peşman olub, xalis tövbə edib, Allah-Təalanın tərəfinə qayıdın.**

**(عَسٰى رَبُّكُمْ اَنْ يُكَفِّرَ عَنْكُمْ سَيِّاٰتِكُمْ وَيُدْخِلَكُمْ جَنَّاتٍ تَجْرٖي مِنْ تَحْتِهَا الْاَنْهَارُ) Tövbə səbəbi ilə sizin rəbbiniz Allah-Təala yəqin ki, sizin günahlarınızdan keçib, qəsrlərinin və ağaclarının altından çaylar axan bağlara sizi daxil edər. (يَوْمَ لَا يُخْزِي اللّٰهُ النَّبِيَّ وَالَّذٖينَ اٰمَنُوا مَعَهُۚ نُورُهُمْ يَسْعٰى بَيْنَ اَيْدٖيهِمْ وَبِاَيْمَانِهِمْ) Allah-Təala o gün** (qiyamət günü) **peyğəmbərini və peyğəmbəri ilə birlikdə iman edənləri zəlil etməz, qiyamətin qaranlığında** (iman) **nurları onların önlərini və sağ tərəflərini aydınlatdığı halda qıl körpüsündən keçərlər. Allah-Təala tövbə edənləri cənnətə daxil edər. (يَقُولُونَ رَبَّنَآ اَتْمِمْ لَنَا نُورَنَا وَاغْفِرْ لَنَاۚ اِنَّكَ عَلٰى كُلِّ شَيْءٍ قَدٖيرٌ)**

يَٓا اَيُّهَا النَّبِيُّ جَاهِدِ الْكُفَّارَ وَالْمُنَافِقِينَ وَاغْلُظْ عَلَيْهِمْ وَمَأْوٰيهُمْ جَهَنَّمُ ۜ وَبِئْسَ الْمَصِيرُ ﴿٩﴾ ضَرَبَ اللّٰهُ مَثَلًا لِلَّذِينَ كَفَرُوا امْرَاَتَ نُوحٍ وَامْرَاَتَ لُوطٍ ۜ كَانَتَا تَحْتَ عَبْدَيْنِ مِنْ عِبَادِنَا صَالِحَيْنِ فَخَانَتَاهُمَا فَلَمْ يُغْنِيَا عَنْهُمَا مِنَ اللّٰهِ شَيْـًٔا وَقِيلَ ادْخُلَا النَّارَ مَعَ الدَّاخِلِينَ ﴿١٠﴾ وَضَرَبَ اللّٰهُ مَثَلًا لِلَّذِينَ اٰمَنُوا امْرَاَتَ فِرْعَوْنَ ۢ اِذْ قَالَتْ رَبِّ ابْنِ لِي عِنْدَكَ بَيْتًا فِي الْجَنَّةِ وَنَجِّنِي مِنْ فِرْعَوْنَ وَعَمَلِهِ وَنَجِّنِي مِنَ الْقَوْمِ الظَّالِمِينَ ۙ ﴿١١﴾ وَمَرْيَمَ ابْنَتَ عِمْرٰنَ الَّتِي اَحْصَنَتْ فَرْجَهَا فَنَفَخْنَا فِيهِ مِنْ رُوحِنَا وَصَدَّقَتْ بِكَلِمَاتِ رَبِّهَا وَكُتُبِهِ وَكَانَتْ مِنَ الْقَانِتِينَ ﴿١٢﴾

---

**- Onlar Allah-Təalaya dua edib deyərlər: "Ey bizim rəbbimiz, nurumuzu söndürməyib, tamamla. Belə ki, onun səbəbinə qiyamətin qorxusundan və qıl körpüsündən keçərkən nicat tapıb cənnətə daxil olaq. Bizi bağışla. Həqiqətən, bağışlamağa və hər bir şeyə qadir olan sənsən.**

**9) (**يَٓا اَيُّهَا النَّبِيُّ جَاهِدِ الْكُفَّارَ وَالْمُنَافِقِينَ وَاغْلُظْ عَلَيْهِمْ**) Ey peyğəmbər, müşriklərlə** (qılınc zərbəsi ilə), **münafiqlərlə** (dəlil və sübutla) **cihad et və bu cihadı edərkən hər iki yolda da onlara qarşı şiddətli və sərt ol. (**وَمَأْوٰيهُمْ جَهَنَّمُ ۜ وَبِئْسَ الْمَصِيرُ**) Kafir və münafiqlərin məskəni cəhənnəmdir və nə pis qayıdılacaq bir yerdir cəhənnəm.**

**10) (**ضَرَبَ اللّٰهُ مَثَلًا لِلَّذِينَ كَفَرُوا امْرَاَتَ نُوحٍ وَامْرَاَتَ لُوطٍ ۜ كَانَتَا تَحْتَ عَبْدَيْنِ مِنْ عِبَادِنَا صَالِحَيْنِ**)** - (Ey Məhəmməd), **Allah-Təala kafirlərdən ötrü** (peyğəmbərlərə, ya da möminlərə soy, ya da başqa cəhətdən kafirlərin yaxın olmasının faydasızlığı baxımından) **Nuh və Lut peyğəmbərlərin xanımlarını məsəl çəkir. Hansı ki, o qadınlar bizim saleh bəndələrimizdən iki bəndəmizin** (Nuh və Lutun) **xanımları idilər. (**فَخَانَتَاهُمَا فَلَمْ يُغْنِيَا عَنْهُمَا مِنَ اللّٰهِ شَيْـًٔا**) - Onlar** (Nuha və Luta) **xəyanət edib, sirlərini kafirlərə verirdilər.** (Nuh və Lut) **xanımlarına bir fayda verməyib, əzabdan onları xilas etməkdə heç bir şey onları Allah-Təaladan qorumayıb, bizim əzabımızdan onları xilas edə bilməzdilər. (**وَقِيلَ ادْخُلَا النَّارَ مَعَ الدَّاخِلِينَ**) Qiyamət günündə onlara deyilər: "Cəhənnəmə daxil olanlarla birlikdə daxil olun.**

**11) (**وَضَرَبَ اللّٰهُ مَثَلًا لِلَّذِينَ اٰمَنُوا امْرَاَتَ فِرْعَوْنَ**)** (Amma möminlərdən ötrü kafirlərə soy, ya da başqa cəhətdən yaxın olmaq heç bir zərər verməz). **Allah-Təala fironun xanımını** (Asiyə) **məsəl çəkir.**

**(**اِذْ قَالَتْ رَبِّ ابْنِ لِي عِنْدَكَ بَيْتًا فِي الْجَنَّةِ وَنَجِّنِي مِنْ فِرْعَوْنَ وَعَمَلِهِ وَنَجِّنِي مِنَ الْقَوْمِ الظَّالِمِينَ**) - O zaman ki, fironun xanımı Allah-Təalaya dua edib dedi: "Ey mənim rəbbim, məndən ötrü cənnətdə bir ev tikib, fironun xəbis nəfsindən və çirkin əməlindən və fironun qövmü olan qibtilərdən mənə nicat ver.**

**12) (**وَمَرْيَمَ ابْنَتَ عِمْرٰنَ الَّتِي اَحْصَنَتْ فَرْجَهَا**) Yenə möminlərdən ötrü Allah-Təala Məryəm İmran qızını məsəl çəkir. Hansı ki, namusunu çirkin əməllərdən qorudu. (**فَنَفَخْنَا فِيهِ مِنْ رُوحِنَا وَصَدَّقَتْ بِكَلِمَاتِ رَبِّهَا وَكُتُبِهِ وَكَانَتْ مِنَ الْقَانِتِينَ**) - Biz də**

**onun bətninə öz ruhumuzdan üfürüb (ona İsa kimi oğul verdik), o da öz rəbbi Allah-Təalanın hökmlərin və kitablarını təsdiq edib, daim ibadət edənlərdən idi.** (Yaxşılıq, nəciblik və insanlıq şəxsin özünə məxsusdur. Ata-ananın, yaxın qohum-əqrəbanın yaxşı, ya da pis olması o şəxsə xeyir və mənfəət, ya da ki, şər və xəsarət yetirən deyildir).

Allaha həmd olsun, Təhrim surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdur: “Kişilərdən kamil şəxslər çox olubdur. Lakin qadınlardan dörd nəfər kamil olubdur. 1- Asiyə Məzahim qızı, fironun xanımı. 2- Məryəm İmran qızı, 3- Xədicə Xuveylid qızı, 4- Fatimeyi-Zəhra Məhəmməd qızı. Allahın Rəsulu buyurdu: “Kim  Təhrim surəsini oxusa, Allah-Təala ona səmimi bir tövbə qismət edər”.

## əl-MÜLK SURƏSİ

67-ci surədir. Məkkədə nazil olub, 30 ayə, 330 kəlmə və 1313 hərfdir.

تَبَارَكَ الَّذِي بِيَدِهِ الْمُلْكُ ۘ وَهُوَ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ ۙ ﴿١﴾ اَلَّذِي خَلَقَ الْمَوْتَ وَالْحَيٰوةَ لِيَبْلُوَكُمْ
اَيُّكُمْ اَحْسَنُ عَمَلًاۜ وَهُوَ الْعَزِيزُ الْغَفُورُ ۙ ﴿٢﴾ اَلَّذِي خَلَقَ سَبْعَ سَمٰوَاتٍ طِبَاقًاۜ مَا تَرٰى فِي خَلْقِ
الرَّحْمٰنِ مِنْ تَفَاوُتٍ ۜ فَارْجِعِ الْبَصَرَ ۙ هَلْ تَرٰى مِنْ فُطُورٍ ﴿٣﴾ ثُمَّ ارْجِعِ الْبَصَرَ كَرَّتَيْنِ يَنْقَلِبْ اِلَيْكَ
الْبَصَرُ خَاسِئًا وَهُوَ حَسِيرٌ ﴿٤﴾ وَلَقَدْ زَيَّنَّا السَّمَآءَ الدُّنْيَا بِمَصَابِيحَ وَجَعَلْنَاهَا رُجُومًا لِلشَّيَاطِينِ

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (تَبَارَكَ الَّذِي بِيَدِهِ الْمُلْكُ ۘ وَهُوَ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ ۙ) - Bir zat ki,** (Allah-Təala) **hər bir məxluqun hökmü onun qüdrətli əlində olsun, elə zat xeyir və bərəkətli və məxluqatın sifətlərindən uca və uludur. Yaradılmamış və təqdir edilmiş olan hər bir şeyə qadir odur. Ondan başqası qadir deyildir.**

**2) (اَلَّذِي خَلَقَ الْمَوْتَ وَالْحَيٰوةَ لِيَبْلُوَكُمْ اَيُّكُمْ اَحْسَنُ عَمَلًاۜ وَهُوَ الْعَزِيزُ الْغَفُورُ ۙ) - O zat** (Allah-Təala) **elə zatdır ki, öz kamil qüdrəti ilə sizdən ötrü ölümü və həyatı yaratdı. Belə ki, siz insanları imtahan etsin ki, hansınız yaxşı əməl sahibi olacaqsınız, ondan sonra o əməlin qarşılığını sizə versin. Məxluqata qalib olub, tövbə edənləri bağışlayan o zatdır** (Allah-Təaladır).

**3) (اَلَّذِي خَلَقَ سَبْعَ سَمٰوَاتٍ طِبَاقًاۜ مَا تَرٰى فِي خَلْقِ الرَّحْمٰنِ مِنْ تَفَاوُتٍ) - O zat** (Allah-Təala) **elə zatdır ki, öz kamil qüdrəti ilə yeddi səmanı bir-birinin üstündə yaratdı.** (Ey Məhəmməd), **Rəhman olan Allah-Təalanın hər bir məxluquna baxanda heç bir uyğunsuzluq və mütənasibsizlik görməyib, bütün hamısını bir-birinə münasib görərsən. (فَارْجِعِ الْبَصَرَ ۙ هَلْ تَرٰى مِنْ فُطُورٍ)** (Ey Məhəmməd), **elə ki, Allah-Təalanın məxluqatına baxıb uyğunsuzluq görmədin, gözlərini çevirib bax, bəs səmalarda parçalanma, dağınıqlıq görürsənmi?**

**4) (ثُمَّ ارْجِعِ الْبَصَرَ كَرَّتَيْنِ يَنْقَلِبْ اِلَيْكَ الْبَصَرُ خَاسِئًا وَهُوَ حَسِيرٌ)** - (Ey Məhəmməd), **bir dəfə baxmaqla kifayət etməyib, gözünü çevirib dəfələrlə diqqətlə səmalara bax, nə qədər diqqətlə baxsan da, heç bir eyib tapmayıb, gözün axtardığı eybi görməyib, aciz və yorğun bir şəkildə öz tərəfinə qayıdar.**

**5) (وَلَقَدْ زَيَّنَّا السَّمَآءَ الدُّنْيَا بِمَصَابِيحَ وَجَعَلْنَاهَا رُجُومًا لِلشَّيَاطِينِ)** - (Ey Məhəmməd), **həqiqətən, biz dünya səmasına çıraqlarla** (ulduzlarla) **zinət verib, ulduzları şeytanlara atılan daş etdik. Ulduzların həqiqətinə agah olmayan şeytan**

وَاَعْتَدْنَا لَهُمْ عَذَابَ السَّعِيرِ ﴿٥﴾ وَلِلَّذِينَ كَفَرُوا بِرَبِّهِمْ عَذَابُ جَهَنَّمَ ۖ وَبِئْسَ الْمَصِيرُ﴿٦﴾ اِذَٓا اُلْقُوا
فِيهَا سَمِعُوا لَهَا شَهِيقًا وَهِيَ تَفُورُ ۙ﴿٧﴾ تَكَادُ تَمَيَّزُ مِنَ الْغَيْظِ ۖ كُلَّمَٓا اُلْقِيَ فِيهَا فَوْجٌ سَاَلَهُمْ خَزَنَتُهَٓا
اَلَمْ يَاْتِكُمْ نَذِيرٌ ﴿٨﴾ قَالُوا بَلٰى قَدْ جَٓاءَنَا نَذِيرٌ فَكَذَّبْنَا وَقُلْنَا مَا نَزَّلَ اللّٰهُ مِنْ شَيْءٍ ۚ اِنْ اَنْتُمْ اِلَّا فِي
ضَلَالٍ كَبِيرٍ ﴿٩﴾ وَقَالُوا لَوْ كُنَّا نَسْمَعُ اَوْ نَعْقِلُ مَا كُنَّا فِيٓ اَصْحَابِ السَّعِيرِ﴿١٠﴾ فَاعْتَرَفُوا بِذَنْبِهِمْ
ۚ فَسُحْقًا لِاَصْحَابِ السَّعِيرِ ﴿١١﴾ اِنَّ الَّذِينَ يَخْشَوْنَ رَبَّهُمْ بِالْغَيْبِ لَهُمْ مَغْفِرَةٌ وَاَجْرٌ كَبِيرٌ ﴿١٢﴾

---

**sifət** (astroloq) **şəxslər şübhəli sözlər deyirlər.** (وَاَعْتَدْنَا لَهُمْ عَذَابَ السَّعِيرِ) **- Belə şəxslərdən ötrü qiyamət günündə yanar od əzabını hazır etmişik.**

**6)** (وَلِلَّذِينَ كَفَرُوا بِرَبِّهِمْ عَذَابُ جَهَنَّمَ ۖ وَبِئْسَ الْمَصِيرُ) **Allah-Təalaya kafir olan şəxslərdən ötrü cəhənnəm əzabı vardır. Nə yaman qayıdılacaq bir yerdir cəhənnəm.**

**7)** (اِذَٓا اُلْقُوا فِيهَا سَمِعُوا لَهَا شَهِيقًا وَهِيَ تَفُورُ ۙ) **- O zaman ki, Allah-Təalaya kafir olanlar cəhənnəmə atıldılar, o vaxt cəhənnəmdən ötrü (ulaq) səsi kimi çirkin bir səs eşidilər. Elə bir halda eşidilər ki,** (qazan içindəki şeyi qaynadan kimi) **cəhənnəm də öz əhlini qaynadar.**

(تَكَادُ تَمَيَّزُ مِنَ الْغَيْظِ ۖ كُلَّمَٓا اُلْقِيَ فِيهَا فَوْجٌ سَاَلَهُمْ خَزَنَتُهَٓا اَلَمْ يَاْتِكُمْ نَذِيرٌ) **- Cəhənnəm kafirlərə qarşı olan qeyz və qəzəbindən az qalır ki, parçalanıb, dağılsın, nə zaman ki, kafirlərdən bir qrup cəhənnəmə salındı, cəhənnəm mühafizləri olan mələklər onlardan soruşarlar ki, bəs sizə Allah-Təala tərəfindən bir qorxuzan** (peyğəmbər) **gəlmədimi?**

**9)** (قَالُوا بَلٰى قَدْ جَٓاءَنَا نَذِيرٌ) **Kafirlər cavabında deyərlər: "Bəli, əlbəttə bizə Allah-Təala tərəfindən qorxuzan gəldi.**

(فَكَذَّبْنَا وَقُلْنَا مَا نَزَّلَ اللّٰهُ مِنْ شَيْءٍ ۚ اِنْ اَنْتُمْ اِلاَّ فِي ضَلاَلٍ كَبِيرٍ) **Lakin biz peyğəmbərləri təkzib edib dedik: "Allah-Təala heç bir şey nazil etməyib, siz özünüzdən yalan deyib, Allah-Təalaya isnad edirsiniz. Siz ancaq böyük xəta və zəlalət içindəsiniz.** (Mələklər onlara deyərlər: "Bəs siz peyğəmbərlərin sözlərini eşidib, dərk etmədinizmi?) **Növbəti ayədə mələklərə verilən cavab qeyd olunur.**

**10)** (وَقَالُوا لَوْ كُنَّا نَسْمَعُ اَوْ نَعْقِلُ مَا كُنَّا فِيٓ اَصْحَابِ السَّعِيرِ) **Kafirlər cavab verib deyərlər: "Əgər biz peyğəmbərlərin sözlərini eşidib dərk etsəydik, cəhənnəm əhlinin arasında olmazdıq. Onların sözlərini dərk etməyib, əməl etmə diyimiz üçün bu əzaba düçar olduq.**

**11)** (فَاعْتَرَفُوا بِذَنْبِهِمْ ۚ فَسُحْقًا لِاَصْحَابِ السَّعِيرِ) - (Ey Məhəmməd), **kafirlər küfr və üsyanlarını belə iqrar edirlər. Cəhənnəm əhli Allah-Təalanın rəhmətindən uzaq olsun, heç bir vaxt Allah-Təalanın rəhməti onlara gəlməyəcəkdir.**

**12)** (اِنَّ الَّذِينَ يَخْشَوْنَ رَبَّهُمْ بِالْغَيْبِ لَهُمْ مَغْفِرَةٌ وَاَجْرٌ كَبِيرٌ) - (Ey Məhəmməd),

وَاَسِرُّوا قَوْلَكُمْ اَوِ اجْهَرُوا بِهٖۜ اِنَّهُ عَلٖيمٌ بِذَاتِ الصُّدُورِ ﴿١٣﴾ اَلَا يَعْلَمُ مَنْ خَلَقَۜ وَهُوَ اللَّطٖيفُ
الْخَبٖيرُ۟ ﴿١٤﴾ هُوَ الَّذٖي جَعَلَ لَكُمُ الْاَرْضَ ذَلُولًا فَامْشُوا فٖي مَنَاكِبِهَا وَكُلُوا مِنْ رِزْقِهٖۜ وَاِلَيْهِ
النُّشُورُ﴿١٥﴾ ءَاَمِنْتُمْ مَنْ فِي السَّمَٓاءِ اَنْ يَخْسِفَ بِكُمُ الْاَرْضَ فَاِذَا هِيَ تَمُورُۙ ﴿١٦﴾ اَمْ اَمِنْتُمْ مَنْ
فِي السَّمَٓاءِ اَنْ يُرْسِلَ عَلَيْكُمْ حَاصِبًاۜ فَسَتَعْلَمُونَ كَيْفَ نَذٖيرِ ﴿١٧﴾ وَلَقَدْ كَذَّبَ الَّذٖينَ مِنْ قَبْلِهِمْ
فَكَيْفَ كَانَ نَكٖيرِ ﴿١٨﴾

---

**həqiqətən, o şəxslər ki, rəbləri Allah-Təalanı görmədikləri halda ondan qorxub, ibadət və itaət edirlər, onlardan ötrü Allah-Təalanın yanında bağışlanmaq və böyük əcr və savab vardır.**

**13)** (وَاَسِرُّوا قَوْلَكُمْ اَوِ اجْهَرُوا بِهٖۜ اِنَّهُ عَلٖيمٌ بِذَاتِ الصُّدُورِ) (Bu ayə bütün asilərə xitab edir, buyurur:) **Danışdığınız sözlərinizi gizlədib bir-birinizlə ya məxfi danışın, ya da ki, aşkar, hər ikisi Allah-Təalanın yanında eynidir. Həqiqətən, Allah-Təala sinələrdə olan sirlərə agahdır.**

**14)** (اَلَا يَعْلَمُ مَنْ خَلَقَۜ وَهُوَ اللَّطٖيفُ الْخَبٖيرُ۟) **- Bəs külli əşyanı yaradıb, zahir və batinə agah olan Allah-Təala sizin gizlin və aşkar sözlərinizi və işlərinizi bilməzmi? Halbuki o, hər bir gizli işə agah və xəbərdardır.**

**15)** (هُوَ الَّذٖي جَعَلَ لَكُمُ الْاَرْضَ ذَلُولًا فَامْشُوا فٖي مَنَاكِبِهَا وَكُلُوا مِنْ رِزْقِهٖۜ وَاِلَيْهِ النُّشُورُ) **Allah-Təala öz kamil qüdrəti ilə yeri zəlil olduğu halda sizdən ötrü yaratdı ki, yer üzündə sizdən ötrü hərəkət etmək çətin olmasın. Yerin ətrafında hərəkət edib, Allah-Təalanın ruzilərindən yeyin, hamınızın qayıdacağı yer Allah-Təalanın tərəfinə olub, nemətlərə şükür edib-etməkdən sorğu-sual olunacaqsınız.**

**16)** (ءَاَمِنْتُمْ مَنْ فِي السَّمَٓاءِ اَنْ يَخْسِفَ بِكُمُ الْاَرْضَ فَاِذَا هِيَ تَمُورُ) **Ey insan nəsli, bəs yer hərəkət edən halda uca mərtəbədə olan Allah-Təalanın sizi yerə batırıb, həlak etməsindən amandasınızmı?**

**17)** (اَمْ اَمِنْتُمْ مَنْ فِي السَّمَٓاءِ اَنْ يُرْسِلَ عَلَيْكُمْ حَاصِبًاۜ فَسَتَعْلَمُونَ كَيْفَ نَذٖيرِ) **Ya da ki, uca bir mərtəbədə olan Allah-Təalanın şiddətli küləklə daşları sizə göndərib, sizi həlak etməsindən əmin-amandasınızmı? Əlbəttə, qiyamət günündə əzab görəndə agah olacaqsınız ki, mənim qorxuzmağım necə oldu? Doğru oldu, yoxsa yox?**

**18)** (وَلَقَدْ كَذَّبَ الَّذٖينَ مِنْ قَبْلِهِمْ فَكَيْفَ كَانَ نَكٖيرِ) - (Ey Məhəmməd), **həqiqətən, səni təkzib edən müşriklərdən əvvəlki müşriklər də onlara göndərilən peyğəmbərləri təkzib etdilər. Bəs mənim onların bu əməllərini inkar edib, xoşlanmamağım necə oldu? Əzab göndərib onları həlak etdim, yoxsa, yox? Habelə səni təkzib edən müşriklərə də əzab göndərib, həlak etməyə qadirəm.**

اَوَلَمْ يَرَوْا اِلَى الطَّيْرِ فَوْقَهُمْ صَٓافَّاتٍ وَيَقْبِضْنَۜ مَا يُمْسِكُهُنَّ اِلَّا الرَّحْمٰنُۜ اِنَّهُ بِكُلِّ شَيْءٍ بَصِيرٌ
﴿١٩﴾ اَمَّنْ هٰذَا الَّذ۪ي هُوَ جُنْدٌ لَكُمْ يَنْصُرُكُمْ مِنْ دُونِ الرَّحْمٰنِۜ اِنِ الْكَافِرُونَ اِلَّا ف۪ي غُرُورٍۚ ﴿٢٠﴾
اَمَّنْ هٰذَا الَّذ۪ي يَرْزُقُكُمْ اِنْ اَمْسَكَ رِزْقَهُۚ بَلْ لَجُّوا ف۪ي عُتُوٍّ وَنُفُورٍ ﴿٢١﴾ اَفَمَنْ يَمْش۪ي مُكِبًّا عَلٰى
وَجْهِه۪ٓ اَهْدٰٓى اَمَّنْ يَمْش۪ي سَوِيًّا عَلٰى صِرَاطٍ مُسْتَق۪يمٍ﴿٢٢﴾ قُلْ هُوَ الَّذ۪ٓي اَنْشَاَكُمْ وَجَعَلَ لَكُمُ السَّمْعَ
وَالْاَبْصَارَ وَالْاَفْـِٔدَةَۜ قَل۪يلًا مَا تَشْكُرُونَ ﴿٢٣﴾

---

**19)** (اَوَلَمْ يَرَوْا اِلَى الطَّيْرِ فَوْقَهُمْ صَٓافَّاتٍ وَيَقْبِضْنَۜ) - (Ey Məhəmməd), **bəs onlar başlarının üstündə səf çəkib, qanad çalıb uçan quşlara baxıb qüdrətimizi anlamırlar ki, necə havada hərəkət edib, uçmalarına qüvvət vermək üçün hər biri özünəməxsus olan qanadlarını necə açıb-yumurlar?**

(مَا يُمْسِكُهُنَّ اِلَّا الرَّحْمٰنُۜ اِنَّهُ بِكُلِّ شَيْءٍ بَصِيرٌ) **Ancaq Allah-Təala öz kamil qüdrəti ilə quşları havada uçan halda saxlayar və o onların hər birini özünəməxsus şəkildə təqdir edib yaradıbdır. Həqiqətən, Allah-Təala necə də yaradıb və necə də hər bir qəribə şeyi təqdir etməyə agah və onların həqiqətini görəndir.**

**20)** (اَمَّنْ هٰذَا الَّذ۪ي هُوَ جُنْدٌ لَكُمْ يَنْصُرُكُمْ مِنْ دُونِ الرَّحْمٰنِۜ) **Ey müşriklər, bu bütlər ki, onlara sitayiş edirsiniz, bəs onlar sizin qoşununuzdur ki, sizə kömək edib, Allah-Təalanın əzabından sizi mühafizə etsinlər? Heyhat, mühafizə etməyə qadir deyildirlər.** (اِنِ الْكَافِرُونَ اِلَّا ف۪ي غُرُورٍۚ) - **Əksinə siz kafirləri** (şəri əmr edən xəbis nəfs) **təkəbbürləndirib, əzabın nazil olmamasına arxayın olubsunuz.**

**21)** (اَمَّنْ هٰذَا الَّذ۪ي يَرْزُقُكُمْ اِنْ اَمْسَكَ رِزْقَهُۚ) **Ey müşriklər, əgər Allah-Təala ruzisini sizdən kəsib, yağış göndərməyib, sizə ruzi verməsə, bəs bu bütlər sizə ruzi verəcəkmi? Heyhat, hardan sizə ruzi verəcəklər?** (بَلْ لَجُّوا ف۪ي عُتُوٍّ وَنُفُورٍ) - (Ey Məhəmməd), **əksinə müşriklər haqdan nifrət edib, təkəbbür və inad edib, asi olmaqda israr edirlər.**

**22)** (اَفَمَنْ يَمْش۪ي مُكِبًّا عَلٰى وَجْهِه۪ٓ اَهْدٰٓى اَمَّنْ يَمْش۪ي سَوِيًّا عَلٰى صِرَاطٍ مُسْتَق۪يمٍ) - (Ey Məhəmməd), **o şəxs ki, naməlum və düz olmayan daşlıq yolda yol gedir, gah üzü üstə yıxılıb, gah durur, o şəxs yolunu düz tapar, yoxsa o şəxs ki, yıxılmaqdan amanda olub, bilinən düz yolda gedir?** (Bəs bəsirət sahibi və bilən şəxslə mənəviyyatı kor və şüursuz şəxs bərabər olarmı?)

**23)** (قُلْ هُوَ الَّذ۪ٓي اَنْشَاَكُمْ وَجَعَلَ لَكُمُ السَّمْعَ وَالْاَبْصَارَ وَالْاَفْـِٔدَةَۜ قَل۪يلًا مَا تَشْكُرُونَ) - (Ey Məhəmməd), **insanlara de ki, sizi yoxluqdan yaradıb, sizdən ötrü hər bir şeyi dərk etməniz üçün qulaq, göz, qəlblər verən Allah-Təaladır. Lakin siz Allah-Təalaya bu nemətlərin müqabilində az şükür edirsiniz.** (Şükür etmək Allah-Təalanın verdiyi nemətləri özünə layiq olan yerdə istifadə etmək-

قُلْ هُوَ الَّذِي ذَرَاَكُمْ فِي الْاَرْضِ وَاِلَيْهِ تُحْشَرُونَ﴿٢٤﴾ وَيَقُولُونَ مَتٰى هٰذَا الْوَعْدُ اِنْ كُنْتُمْ صَادِقِينَ﴿٢٥﴾ قُلْ اِنَّمَا الْعِلْمُ عِنْدَ اللّٰهِۖ وَاِنَّمَٓا اَنَا۬ نَذِيرٌ مُبِينٌ ﴿٢٦﴾ فَلَمَّا رَاَوْهُ زُلْفَةً سٖيئَتْ وُجُوهُ الَّذِينَ كَفَرُوا وَقِيلَ هٰذَا الَّذِي كُنْتُمْ بِهٖ تَدَّعُونَ ﴿٢٧﴾ قُلْ اَرَاَيْتُمْ اِنْ اَهْلَكَنِيَ اللّٰهُ وَمَنْ مَعِيَ اَوْ رَحِمَنَاۙ فَمَنْ يُجِيرُ الْكَافِرِينَ مِنْ عَذَابٍ اَلِيمٍ﴿٢٨﴾ قُلْ هُوَ الرَّحْمٰنُ اٰمَنَّا بِهٖ وَعَلَيْهِ تَوَكَّلْنَاۚ فَسَتَعْلَمُونَ مَنْ هُوَ فٖي ضَلَالٍ مُبٖينٍ ﴿٢٩﴾

---

dən ibarətdir. İnsanlar bu mətləbi çox vaxt unutduğu üçün buyurur: “Az vaxt şükür edirsiniz).

**24) (قُلْ هُوَ الَّذِي ذَرَاَكُمْ فِي الْاَرْضِ وَاِلَيْهِ تُحْشَرُونَ)** - (Ey Məhəmməd), **insanlara de ki, sizi yer üzündə öz kamil qüdrəti ilə yaradıb, yayan Allah-Təaladır. Ölüm sizə gələndən sonra hamınız onun tərəfinə qayıdacaqsınız. Necə ki, sizi daha əvvəl yaratmağa qadir oldu, yenidən həyat verib, bir yerə yığmağa da qadirdir. Nəyə əsasən qiyaməti inkar edirsiniz?**

**25) (وَيَقُولُونَ مَتٰى هٰذَا الْوَعْدُ اِنْ كُنْتُمْ صَادِقِينَ) - Müşriklər sənə və möminlərə istehza edib deyirlər: “Bu qiyamət ki, vəd edirsiniz, nə vaxt olacaqdır? Əgər doğru deyirsinizsə, onun vaxtını bizə bəyan edin.**

**26) (قُلْ اِنَّمَا الْعِلْمُ عِنْدَ اللّٰهِۖ وَاِنَّمَٓا اَنَا۬ نَذِيرٌ مُبِينٌ)** - (Ey Məhəmməd), **de ki, qiyamətin elmi Allah-Təalanın yanındadır və həqiqətən, mən sizi Allah-Təalanın əzabı ilə aşıq-aşkar qorxudanam. Mənim işim ancaq sizi Allah-Təalanın tərəfinə - tövhidə dəvət edib, onun əzabından qorxutmaqdır. Qiyamət nə vaxt olacaq, onu ancaq Allah-Təala bilir.**

**27) (فَلَمَّا رَاَوْهُ زُلْفَةً سٖيئَتْ وُجُوهُ الَّذِينَ كَفَرُوا وَقِيلَ هٰذَا الَّذِي كُنْتُمْ بِهٖ تَدَّعُونَ)** - (Ey Məhəmməd), **o zaman ki, müşriklər vəd edilən əzabı yaxından gördülər, o vaxt onların üzləri qəmli və məhzun olub, qaralar. Bizim tərəfimizdən onlara deyilər: “O əzab ki, dünyada tələsib, onu istəyirdiniz, bu həmin əzabdır, indi onu görəndə niyə qəmlənirsiniz?** (Müşriklər Məkkədə dua edib, peyğəmbərin və möminlərin həlak olmasını istəyirdilər. Növbəti ayə o haqda nazil oldu).

**28) (قُلْ اَرَاَيْتُمْ اِنْ اَهْلَكَنِيَ اللّٰهُ وَمَنْ مَعِيَ اَوْ رَحِمَنَاۙ فَمَنْ يُجِيرُ الْكَافِرِينَ مِنْ عَذَابٍ اَلِيمٍ)** - (Ey Məhəmməd), **müşriklərə de ki, mənə xəbər verin, əgər necə ki, siz istəyirsiniz, Allah-Təala məni və möminləri həlak etsə, ya da ki, bizə rəhm edib, əcəlimizi təxirə salsa, bəs siz kafirlərə Allah-Təalanın əzabından kim nicat verəcək? Biz həlak olsaq, siz nicat tapacaqsınızmı?**

**29) (قُلْ هُوَ الرَّحْمٰنُ اٰمَنَّا بِهٖ وَعَلَيْهِ تَوَكَّلْنَاۚ فَسَتَعْلَمُونَ مَنْ هُوَ فٖي ضَلَالٍ مُبٖينٍ)** - (Ey Məhəmməd), **kafirlərə de ki, Rəhman olan Allah-Təaladır ki, biz ona iman edib, təvəkkül etmişik. Əlbəttə, qiyamət günündə agah olacaqsınız ki, açıq-aşkar zəlalətdə olan kimdir, biz, yoxsa, siz ?**

قُلْ اَرَاَيْتُمْ اِنْ اَصْبَحَ مَآؤُكُمْ غَوْرًا فَمَنْ يَاْتِيكُمْ بِمَآءٍ مَعِينٍ ﴿٣٠﴾

---

**30) (قُلْ اَرَاَيْتُمْ اِنْ اَصْبَحَ مَآؤُكُمْ غَوْرًا فَمَنْ يَاْتِيكُمْ بِمَآءٍ مَعِينٍ)** - (Ey Məhəmməd), **müşriklərə de ki, mənə xəbər verin, əgər sizin suyunuz yerin dibinə batıb, ondan bir iz qalmasa, bəs sizdən ötrü dadlı suyu kim gətirər? (Bu ayə zındıq bir şəxsin yanında oxundu. Dedi: "O suyu külək gətirər." O şəxsin gözü kor oldu. Gözünün suyunu geri gətirmək, sağaltmaq mümkün olmadı).**

Allaha həmd olsun, əl-Mülk surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: "Kim əl-Mülk surəsini oxusa, Qədir gecəsini ibadətlə keçirmiş kimi olar."

## əl-QƏLƏM SURƏSİ

68-ci surədir. Məkkədə nazil olub, 52 ayə, 300 kəlmə və 1256 hərfdir.

نٓ وَالْقَلَمِ وَمَا يَسْطُرُونَ ﴿١﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (نٓ وَالْقَلَمِ وَمَا يَسْطُرُونَ) And olsun mürəkkəbə, qələmə və onlarla katiblərin yazdığı sözlərə.**

**(*Qeyd:** *Təfsirçilər Nun və qələm barəsində müxtəlif və etibarsız sözlər deyiblər, o cümlədən deyiblər: "Nun bir balıqdır, o balığın üstündə bir daş, daşın üstündə bir öküz vardır. O öküzün qırx min buynuzu və qırx min ayağı vardır. Öküzün boynunda bir yaşıl yaqut vardır. Onun qalınlığı beş yüz il yoldur. O yaqutun üstündə bir mələk vardır. Bizim bu məskun olduğumuz yer onun çiynində yerləşir. Yoxsa yer bir tərəfə düşüb dağılardı. Habelə qələm barəsində deyiblər: "Nurdan bir qələmdir, onun uzunluğu yerdən göyə qədərdir. Bundan başqa da sözlər deyiblər ki, onların qeyd edilməsi bezdirici olduğundan onlardan imtina etdim. Yuxarıda qeyd etdiyim ancaq bir nümunədir. (Farsca ifadə) Bunlar kifayət edər. Adlarını təfsirçi qoyanların belə kəlamlar yazması təəccüblü deyilmi? Qurani-Şərif başdan-ayağa hər bir ayəsində aləmin yaradıcısının kamil qüdrətinə işarə edir. Təfsirçilər isə belə mənasız sözlərlə Allah-Təalanın qüdrətinə əskiklik gətirirlər. Biçarələr həmin mürəkkəb və qələmin faydasından və nə dərəcədə Allah-Təalanın onlara əhəmiyyət verib, onlara and içməyindən xəbərsiz qalıb, məntiqsiz və etibarsız, külünc sözlər yazıb, küləyin yelinə veriblər. Allah-Təala bu mübarək surədə mürəkkəb və qələmə and içməklə elm və kitaba əhəmiyyət verib, biz Quran əhlini elmə və kitab oxumağa həvəsləndirmək istəyir. Adlarını təfsirçi qoyub, xalq arasında "höccətül-islam" ("islamın dəlili"), "şəriətmədar" ("şəriətin dayağı"), "islamın rəisi" adı ilə məşhur olanlar Qurani-Şərifin belə zəruri mətləblərini bir kənara qoyub, belə boş-boş sözlər yazıb, insanların zehinlərini pozub qarışdırırlar, vay islamın bu yazıq halına, müsəlmanların belə cəhalət və vəhşiliyə düçar olması bu kimi yazılardan deyilmi? Biçarələr Allah-Təalanın kamil qüdrətinə agah olmayıb, yeri daşıyan bir sıra məxluqları "kəşf" etdikləri kimi, ulduzlardan ötrü də bir məqam və bir mənzil təyin ediblər. Əgər o məqamlar olmasa, guya onların hamısı pərakəndə olub dağılarlar. Guya mütləq qüdrət sahibi olan Allah-Təala onları sonsuz fəzada istinadsız saxlamağa acizdir. Halbuki Qurani-Şərifdə oxuyurlar: "O, hər bir şeyə qadirdir". İbrət götürüb, haqqı görmək, haqqı, batili dərk etmək lazımdır, necə ki, əmirəl-möminin Əli (ə.s)*

مَٓا اَنْتَ بِنِعْمَةِ رَبِّكَ بِمَجْنُونٍۚ ﴿٢﴾ وَاِنَّ لَكَ لَاَجْرًا غَيْرَ مَمْنُونٍۚ ﴿٣﴾ وَاِنَّكَ لَعَلٰى خُلُقٍ عَظٖيمٍ ﴿٤﴾

---

*buyurur: "söz deyənə baxma, deyilən sözə bax". Gərək sözə baxıb haqqı, batili anlayaq. "Bu sözü hansı alim deyib? Əgər filan alim desəydi, mən onu qəbul edərdim" kimi sözlər elmsizlikdən, cəhalətdən yaranan sözlərdir. Adlarını təfsirçi qoyub, belə cəhalətə bais olan sözləri deyənlər, əgər coğrafiya elminə agah olsaydılar, hər halda belə sözlər deməz, Allah-Təalanın qüdrətinə xələl gətirəcək ifadələr işlətməzdilər. Qurani-Şərifin elm və maarifə dair açıq-aydın ayələrinin necə kənarda qaldığı həqiqət üzrə bəyan olundu ki, islam ümməti ondan faydalana bilsin. Qurani-Şərifin dərin ayələrini təfəkkür etmək lazımdır.*

**2) (مَٓا اَنْتَ بِنِعْمَةِ رَبِّكَ بِمَجْنُونٍۚ)** - (Ey Məhəmməd), **Allah-Təala sənə ağıl-kamal, fəsahət və bəlağət, bol nemət verdiyi halda daha niyə dəli olursan? Əlbəttə, dəli deyilsən.** (Müşriklər sənə olan həsəd və ədavətlərindən belə deyirlər).

**3) (وَاِنَّ لَكَ لَاَجْرًا غَيْرَ مَمْنُونٍۚ)** - (Ey Məhəmməd), **həqiqətən, peyğəmbərliyi təbliğ edib, müşriklərin əziyyətlərinə səbir etməndə səndən ötrü minnət qoyulmayan əcr və savab vardır, çünki əməl müqabilində əcr-savab verən hikmət sahibinin minnət qoyması layiq deyildir.**

**4) (وَاِنَّكَ لَعَلٰى خُلُقٍ عَظٖيمٍ)** - (Ey Məhəmməd), **həqiqətən, sən gözəl əxlaqın* ən böyük və uca dərəcəsindəsən və bu səbəbdən müşriklərin hər bir əziyyətinə dözüb, peyğəmbərliyi təbliğ işində möhkəm oldun.**

**(*Qeyd:** *"Digər peyğəmbərlər də peyğəmbərliyi təbliğ işində möhkəm olub, insanların verdiyi əziyyətlərə səbir ediblər. Lakin bizim uca peyğəmbərimiz digər peyğəmbərlər arasında ən gözəl əxlaqa sahib olduğu üçün Allah-Təala bu ayədə onun əxlaqını daha böyük hesab edir. Səid ibn Hişam möminlərin anası Aişədən belə rəvayət edib: "Peyğəmbərin əxlaqı Qurandan ibarətdir, bəs Muminun surəsini ("Həqiqətən, möminlər nicat tapmışlar.....") oxumayıbsız?" (Müslüm, Misafirin, 139) Cabir ibn Abdullah Ənsari peyğəmbərdən rəvayət edib deyir: "Allahın Rəsulu buyurdu: "Allah-Təala məni göndərib ki, sizin gözəl əxlaqınızı tamamlayım" (Muvatta, Hüsnül-Xulq, 8). Nəvvas ibn Səm`an deyir: "peyğəmbərdən soruşdum ki, yaxşı nədir, pis nədir?" Buyurdu: "Yaxşı şey gözəl əxlaqdır, pis şey isə başqalarının haqqında onların qəlbini narahat edən sözlər deməkdir" (Müslüm, Birr, 15). Aişə deyir: "Allahın Rəsulundan eşitdim, buyurdu: "mömin şəxs gözəl əxlaqı ilə gündüzlər oruc tutub, gecələr ibadət edənlərin səviyyəsinə ucalar" (Əbu Davud, Sünən, Ədəb, 7). Yenə Aişə deyir: "Allahın Rəsulu buyurdu: "imanları kamil olanlar gözəl əxlaq sahibləri və ailələrinə qarşı mehriban, incə və mərhəmətli şəxslərdən ibarətdir". Ənəs ibn Malik deyir: "On il mən peyğəmbərə xidmət etdim, bir dəfə də mənə "of", ya da ki, "niyə filan şeyi etdin, ya da eləmədin?", demədi (Əhməd ibn Hənbəl, III/107). Ənəs ibn Malik deyir: "əgər bir şəxs peyğəmbərlə*

فَسَتُبْصِرُ وَيُبْصِرُونَۙ ﴿٥﴾ بِاَيِّكُمُ الْمَفْتُونُ ﴿٦﴾ اِنَّ رَبَّكَ هُوَ اَعْلَمُ بِمَنْ ضَلَّ عَنْ سَبِيلِهِۖ وَهُوَ اَعْلَمُ بِالْمُهْتَدِينَ ﴿٧﴾ فَلَا تُطِعِ الْمُكَذِّبِينَ ﴿٨﴾ وَدُّوا لَوْ تُدْهِنُ فَيُدْهِنُونَ ﴿٩﴾ وَلَا تُطِعْ كُلَّ حَلَّافٍ مَهِينٍۙ ﴿١٠﴾ هَمَّازٍ مَشَّٓاءٍ بِنَمِيمٍۙ ﴿١١﴾

---

*qarşılaşıb, onunla əllə salamlaşsaydı, o şəxs əlini çəkmədikcə, peyğəmbər əlini çəkməz və üzünü döndərməzdi" (Tirmizi, Sünən, Ədəb, 21). Peyğəmbərin gözəl əxlaqı haqqında xeyli hədis rəvayət olunubdur. Hamısını qeyd etmək uzunçuluq olar. Bu hədislərə diqqət etmək lazımdır. İnsanlıqda və məişətdə gözəl əxlaq ilk şərt olduğu üçün imanın kamilləşməsi əxlaqın gözəlləşməsi ilə mütənasib olub, imanları kamil olan şəxslər həm də gözəl əxlaq sahibləridir. Peyğəmbər belə buyurub. İnsanlara pislik edib, gecə namaz qılanlar, zülm edib oruc tutanlar, oğurluq edib Məkkəyə gedənlər, qohumlarla əlaqəsini kəsib, əhli-beytə ağlayanlar gözəl əxlaq sahibi deyil. Biz adımızı müsəlman qoyub, uca peyğəmbərimizi unutmuşuq, ona tabe olmaq əvəzinə Yezid ibn Müaviyəyə, Ziyad ibn Əbihə, Übeydullah ibn Ziyada, Həccac ibn Yusifə, Əbu Müslim Xorasaniyə tabe olmuşuq. İslam düşmənləri islama qarışıqlıq salıb, az qalıblar ki, islamın təməlini bərbad etsinlər. Bir halda ki, cəhalət və nadanlıq pərdəsi gözlərdən götürülməyib, elm və maarif nuru ilə gözlərə sürmə çəkilməyib, alim libasına bürünmüş islam düşmənlərini tanımaq xeyli çətindir. İslam ümmətinin rəislərinin ilk vəzifəsi müsəlmanların arasında elmi yaymaq olmalıdır. Təfəkkür etmək lazımdır).*

**5-6) (فَسَتُبْصِرُ وَيُبْصِرُونَ بِاَيِّكُمُ الْمَفْتُونُ)** - (Ey Məhəmməd), **sən və müşriklər görürsünüz ki, dəli sənsən, yoxsa onlardır.**

**7) (اِنَّ رَبَّكَ هُوَ اَعْلَمُ بِمَنْ ضَلَّ عَنْ سَبِيلِهِۖ وَهُوَ اَعْلَمُ بِالْمُهْتَدِينَ)** - (Ey Məhəmməd), **sənin rəbbin Allah-Təala onun yolundan azanlara, həqiqətən dəli olanlara agahdır və yenə hidayət tapıb, iman edənlərdən də Allah-Təala agahdır.**

**8) (فَلَا تُطِعِ الْمُكَذِّبِينَ)** - (Ey Məhəmməd), **heç bir işdə səni təkzib edən müşriklərə itaət etmə, onların rəylərində bir xeyir yoxdur.**

**9) (وَدُّوا لَوْ تُدْهِنُ فَيُدْهِنُونَ)** - (Ey Məhəmməd), **müşriklər istəyirlər ki, kaş sən onlarla mülayim rəftar edib, dinlərinə eyib tutmayasan, o vaxt onlar da səninlə mülayim rəftar etsinlər. Amma bu iş sənə rəva deyildir. Əksinə dində möhkəm durub, gərək müşriklərlə şiddət və mətanətlə rəftar edəsən.**

**10) (وَلَا تُطِعْ كُلَّ حَلَّافٍ مَهِينٍۙ)** - (Ey Məhəmməd), **hər bir zəlilə və haqq-nahaq çox and içən şəxsin sözünə itaət etmə.** (Çox and içən hərçənd haqq olan məsələdə də and içsə, zəlildir).

**11) (هَمَّازٍ مَشَّٓاءٍ بِنَمِيمٍۙ) Habelə insanların arasında söz gəzdirib, eyib tutub, tənə edənlərə də itaət etmə.**

مَنَّاعٍ لِلْخَيْرِ مُعْتَدٍ اَثِيمٍ ﴿١٢﴾ عُتُلٍّ بَعْدَ ذٰلِكَ زَنِيمٍ ﴿١٣﴾ اَنْ كَانَ ذَا مَالٍ وَبَنِينَ ﴿١٤﴾ اِذَا
تُتْلٰى عَلَيْهِ اٰيَاتُنَا قَالَ اَسَاطِيرُ الْاَوَّلِينَ﴿١٥﴾ سَنَسِمُهُ عَلَى الْخُرْطُومِ﴿١٦﴾ اِنَّا بَلَوْنَاهُمْ كَمَا بَلَوْنَآ
اَصْحَابَ الْجَنَّةِ اِذْ اَقْسَمُوا لَيَصْرِمُنَّهَا مُصْبِحِينَ ﴿١٧﴾ وَلَا يَسْتَثْنُونَ ﴿١٨﴾

---

**12) (مَنَّاعٍ لِلْخَيْرِ مُعْتَدٍ اَثِيمٍ) Fasiq və zülmdə həddi aşan xəsis şəxslərə də itaət etmə.**

**13) (عُتُلٍّ بَعْدَ ذٰلِكَ زَنِيمٍ) Qəzəbli, zülm edən və özünü yalandan bir soya nisbət edən şəxslərə də itaət etmə.** (Bu ayələr Məkkədə Vəlid ibn Müğirə haqqında nazil olubdur. Qüreyşdən olmayıb özünü Qüreyşə nisbət etmişdi. Belə şəxsə ərəblər “bic, soyu şübhəli” deyirlər. Vəlid ibn Müğirə Məkkədə varlı bir şəxs idi və on oğlu var idi. Oğlanlarından biri də məşhur şücaətli qəhrəman Xalid ibn Vəliddir ki, islama daxil olub, islamın yayılması üçün xeyli iş görmüşdür. Şücaətini qeyd etməyə ehtiyac yoxdur).

**14) (اَنْ كَانَ ذَا مَالٍ وَبَنِينَ) - Bir də dünya malı və oğlanları olduğu üçün belə şəxsə itaət edib, sözünə qulaq asma. İman lazımdır. İman olmayanda mal və övlad da fayda verməz.**

**15) (اِذَا تُتْلٰى عَلَيْهِ اٰيَاتُنَا قَالَ اَسَاطِيرُ الْاَوَّلِينَ) - O zaman ki, bizim ayələrimiz** (Qurani-Şərif) **belə şəxsə oxunar, qəbul etməyib deyər: “Bunlar əvvəlkilərin yalan-palan və faydasız hekayələridir.**

**16) (سَنَسِمُهُ عَلَى الْخُرْطُومِ) - Belə şəxsin burnuna damğa vurub, onu müşriklər arasında zəlil və həqir edərik.** (Necə ki, heyvanın burnuna damğa vurulur, Vəlidi zəlil etməyə nümunə vermək üçün də onun burnuna damğa vurmaq ifadəsi işlədildi. İslam qalib gəlib, Vəlid zəlil oldu). (Peyğəmbərdən əvvəlki dövrlərdə Yəməndə bir şəxs olub, onun gözəl bağları və bağlarında hər bir növ meyvə var idi. O şəxs meyvə dərilən vaxtı bağdan özünün bir illik ruzisini götürüb, qalanını kasıblara paylayardı. Elə ki, o şəxs vəfat etdi, oğlanları yığılıb, bir-birilərinə dedilər: “Əgər biz də atamız kimi rəftar etsək, ruzimiz azalar. Bizim ailəmiz var. Səhər tezdən kasıblar xəbər tutmamış, bağa gedib meyvələri toplayaq. Gecə o xəyalla yatdılar. Allah-Təala onların bağlarına bəla göndərib, hamısı yanıb məhv oldu. Səhər tezdən durub, bağa gedib, bağdan bir iz görməyəndə dedilər: “Yəqin səhv etmişik. Ondan sonra diqqətlə baxıb, bağlarını o halda görəndə peşman oldular. Onların ədalətli bir qardaşı var idi, belə çirkin əməli onlara qadağan edib, atalarının gözəl yoluna tabe olmağı onlara əmr etdi. Ona itaət etmədilər. Bağlarını o halda görəndə, o adil qardaş onlara məzəmmət etməyə başladı. Necə ki, növbəti ayələrdə Allah-Təala bu əhvalata işarə edib, Qüreyş camaatına da əzab edəcəyi vədinə eyham vurur).

**17-18) (اِنَّا بَلَوْنَاهُمْ كَمَا بَلَوْنَآ اَصْحَابَ الْجَنَّةِ اِذْ اَقْسَمُوا لَيَصْرِمُنَّهَا مُصْبِحِينَ وَلَا يَسْتَثْنُونَ) -** (Ey Məhəmməd), **biz Məkkə əhlini qıtlıq və aclığa düçar etdik. Necə ki, o**

فَطَافَ عَلَيْهَا طَائِفٌ مِنْ رَبِّكَ وَهُمْ نَائِمُونَ ﴿١٩﴾ فَاَصْبَحَتْ كَالصَّرِيمِ ﴿٢٠﴾ فَتَنَادَوْا مُصْبِحِينَ
﴿٢١﴾ اَنِ اغْدُوا عَلٰى حَرْثِكُمْ اِنْ كُنْتُمْ صَارِمِينَ﴿٢٢﴾ فَانْطَلَقُوا وَهُمْ يَتَخَافَتُونَ ﴿٢٣﴾ اَنْ
لَا يَدْخُلَنَّهَا الْيَوْمَ عَلَيْكُمْ مِسْكِينٌ﴿٢٤﴾ وَغَدَوْا عَلٰى حَرْدٍ قَادِرِينَ﴿٢٥﴾ فَلَمَّا رَاَوْهَا قَالُوٓا اِنَّا
لَضَٓالُّونَ ﴿٢٦﴾ بَلْ نَحْنُ مَحْرُومُونَ﴿٢٧﴾ قَالَ اَوْسَطُهُمْ اَلَمْ اَقُلْ لَكُمْ لَوْلَا تُسَبِّحُونَ ﴿٢٨﴾

---

**bağ sahiblərini də düçar edib, bağlarına bəla göndərdik. O zaman ki, bir-birləri ilə məşvərət edib and içdilər ki, səhər tezdən kasıblar xəbərdar olmamış bağın meyvələrini dərsinlər, and içdilər, lakin "inşallah" demədilər və bu səbəbdən onların bağlarına bəla göndərdik.** (Bir işi Allah-Təalaya həvalə edib, inşallah deyilməsə, o iş olmaz).

**19)** **(فَطَافَ عَلَيْهَا طَائِفٌ مِنْ رَبِّكَ وَهُمْ نَائِمُونَ)** - (Ey Məhəmməd), **gecə onlar yatdıqları halda, sənin rəbbin Allah-Təala tərəfindən onların bağlarına əzab gəlib, yaxaladı.**

**20) (فَاَصْبَحَتْ كَالصَّرِيمِ) - Əzab səbəbi ilə onların bağları və meyvələri, ağacları məhv oldu, bağlarının meyvələri dərilmiş kimi olub, ağacları da yanıb kül oldu.**

**21-22) (فَتَنَادَوْا مُصْبِحِينَ اَنِ اغْدُوا عَلٰى حَرْثِكُمْ اِنْ كُنْتُمْ صَارِمِينَ) Amma qardaşlar bağdan bixəbər sübh tezdən bir-birlərini çağırıb dedilər: "Əgər meyvələri dərəcəksinizsə, sübh tezdən kasıblar xəbər tutmamış meyvələrinizə tərəf gedib, dərib qurtarın.**

**23-24) (فَانْطَلَقُوا وَهُمْ يَتَخَافَتُونَ اَنْ لَا يَدْخُلَنَّهَا الْيَوْمَ عَلَيْكُمْ مِسْكِينٌ) - Birlikdə yola düşdülər. Gizlicə bir-birilərinə deyirdilər: "Gərək bu gün bağda yanınıza kasıb gəlməsin** (yəni daxil olmağa qoymayın), **kasıblara heç bir şey verməyin.**

**25) (وَغَدَوْا عَلٰى حَرْدٍ قَادِرِينَ)** - (Ey Məhəmməd), **onlar kasıblara xeyir verməyə qadir olduqları halda onları məhrum etməyə çalışdılar. Səhərə elə bir halda çıxdılar ki, malları gedib, özləri kasıblaşmışdılar, sanki kasıbları məhrum etməkdən başqa heç bir şeyə qadir deyildilər. Xeyir verməyə qadir olduqları halda xəbis niyyətlərinin səbəbindən aciz oldular.**

**26) (فَلَمَّا رَاَوْهَا قَالُوٓا اِنَّا لَضَٓالُّونَ) - Bağa yetişib, onu pis bir halda görəndə dedilər: "Həqiqətən, biz yoldan azmışıq, burada bağ yoxdur."**

**27) (بَلْ نَحْنُ مَحْرُومُونَ) - Ondan sonra fikir verib gördülər ki, həmin bağdır, dedilər: "Bəlkə nəfsimizə zülm edib, kasıblara mane olduğumuz üçün xeyirdən məhrum olub, bağımız da məhv olubdur.**

**28) (قَالَ اَوْسَطُهُمْ اَلَمْ اَقُلْ لَكُمْ لَوْلَا تُسَبِّحُونَ) - O zaman o qardaşların adil və yaxşı olanı onlara dedi: "Bəs əvvəlcə belə çirkin işə siz başladıqda,**

قَالُوا سُبْحَانَ رَبِّنَآ اِنَّا كُنَّا ظَالِمِينَ﴿٢٩﴾ فَاَقْبَلَ بَعْضُهُمْ عَلٰى بَعْضٍ يَتَلَاوَمُونَ﴿٣٠﴾ قَالُوا يَا وَيْلَنَآ
اِنَّا كُنَّا طَاغِينَ﴿٣١﴾ عَسٰى رَبُّنَآ اَنْ يُبْدِلَنَا خَيْرًا مِنْهَآ اِنَّآ اِلٰى رَبِّنَا رَاغِبُونَ ﴿٣٢﴾ كَذٰلِكَ الْعَذَابُ
وَلَعَذَابُ الْاٰخِرَةِ اَكْبَرُ لَوْ كَانُوا يَعْلَمُونَ ﴿٣٣﴾ اِنَّ لِلْمُتَّقِينَ عِنْدَ رَبِّهِمْ جَنَّاتِ النَّعِيمِ﴿٣٤﴾ اَفَنَجْعَلُ
الْمُسْلِمِينَ كَالْمُجْرِمِينَ ﴿٣٥﴾ مَا لَكُمْ كَيْفَ تَحْكُمُونَ ﴿٣٦﴾

---

**demədim ki, Allah-Təalanı zikr edib, belə xəbis niyyətdən tövbə edin? Mənim sözümə itaət etmədiniz.**

**29) (قَالُوا سُبْحَانَ رَبِّنَآ اِنَّا كُنَّا ظَالِمِينَ) Elə ki, əməllərinin çirkinliyi onlara məlum oldu, dedilər: "Bizim rəbbimiz Allah-Təala zülmdən pak və müqəddəsdir. Həqiqətən, biz özümüz özümüzə zalım olduq.**

**30) (فَاَقْبَلَ بَعْضُهُمْ عَلٰى بَعْضٍ يَتَلَاوَمُونَ) - Ondan sonra bir-birilərinə baxıb, bir-birlərini məzəmmət etdilər.**

**31) (قَالُوا يَا وَيْلَنَآ اِنَّا كُنَّا طَاغِينَ) - Dedilər: vay olsun bizə, kasıbların haqqını yeyib, asi və günahkar olduq.**

**32) (عَسٰى رَبُّنَآ اَنْ يُبْدِلَنَا خَيْرًا مِنْهَآ اِنَّآ اِلٰى رَبِّنَا رَاغِبُونَ) - Ondan sonra əməllərindən peşman olub tövbə edib dedilər: "Ümidimiz budur ki, rəbbimiz Allah-Təala bunun əvəzinə bundan da yaxşı bağı bizə versin. Həqiqətən, biz rəbbimiz Allah-Təalaya yönəlib, ondan xeyir istəyib, bizi əfv etməsini xahiş edirik.** (İbn Məsud) **deyir: "Onlar həqiqətən tövbə edib, doğruluqları məlum oldu. Allah-Təala o bağın əvəzinə onlara gözəl bir bağ bəxş edib, o bağın adına "Həyəvan" deyilirdi).**

**33) (كَذٰلِكَ الْعَذَابُ)** - (Ey Məhəmməd), **bu əzab ki, Məkkə əhlini və bağ sahiblərini düçar etdik. Bunlar dünya əzabıdır, hansı ki, bu əzablara dözmək üçün onlarda dözüm yox idi.**

**(وَلَعَذَابُ الْاٰخِرَةِ اَكْبَرُ لَوْ كَانُوا يَعْلَمُونَ) Amma asilər üçün axirətin əzabı dünya əzabından böyük və daha şiddətlidir. Əgər axirət əzabının şiddətinə agah olsalar, əzaba bais olan əməllərə yönəlməzlər.**

**34) (اِنَّ لِلْمُتَّقِينَ عِنْدَ رَبِّهِمْ جَنَّاتِ النَّعِيمِ)** - (Ey Məhəmməd), **həqiqətən, müttəqilərdən ötrü rəbləri Allah-Təalanın yanında nemətləri həmişə olan cənnətlər vardır.** (Müşriklər deyirdilər: "Əgər Məhəmmədin - axirətdə gözəl nemətlər olacaqdır və insanlar yenidən həyata gələcəkdir, sözü doğru olsa da, yenə bizim nemətlərimiz müsəlmanlardan çox olar, necə ki, dünyada da çoxdur, əgər çox olmasa da, hər halda onlarla bərabər səviyyədə olar. Allah-Təala növbəti ayədə onların bu inamlarını rədd edir).

**35-36) (اَفَنَجْعَلُ الْمُسْلِمِينَ كَالْمُجْرِمِينَ مَا لَكُمْ كَيْفَ تَحْكُمُونَ) Bəs biz hökmdə zülm edib, axirətdə müsəlmanları və bizə itaət edənləri müşrik və asilərlə bəra-**

اَمْ لَكُمْ كِتَابٌ فِيهِ تَدْرُسُونَۙ ﴿٣٧﴾ اِنَّ لَكُمْ فِيهِ لَمَا تَخَيَّرُونَۚ ﴿٣٨﴾ اَمْ لَكُمْ اَيْمَانٌ عَلَيْنَا بَالِغَةٌ اِلٰى يَوْمِ الْقِيٰمَةِۙ اِنَّ لَكُمْ لَمَا تَحْكُمُونَۚ ﴿٣٩﴾ سَلْهُمْ اَيُّهُمْ بِذٰلِكَ زَعِيمٌۚ ﴿٤٠﴾ اَمْ لَهُمْ شُرَكَٓاءُۚ فَلْيَاْتُوا بِشُرَكَٓائِهِمْ اِنْ كَانُوا صَادِقِينَ﴿٤١﴾ يَوْمَ يُكْشَفُ عَنْ سَاقٍ وَيُدْعَوْنَ اِلَى السُّجُودِ فَلَا يَسْتَطِيعُونَۙ ﴿٤٢﴾ خَاشِعَةً اَبْصَارُهُمْ تَرْهَقُهُمْ ذِلَّةٌۜ

---

**bər və eyni tutarıq? Ey müşriklər, sizə nə olubdur ki, belə əyri və haqdan uzaq hökm verirsiniz? Guya istədiyiniz kimi hökm etməniz üçün cəza və mükafat işi sizə həvalə olunub.**

**37-38) (اَمْ لَكُمْ كِتَابٌ فِيهِ تَدْرُسُونَۙ اِنَّ لَكُمْ فِيهِ لَمَا تَخَيَّرُونَۚ) Yoxsa sizdən ötrü səmadan bir kitab gəlibdir və o kitabda qeyd olunubdur ki, nə istəsəniz, sizdən ötrü axirətdə hazır və mövcud olacaqdır?**

**39) (اَمْ لَكُمْ اَيْمَانٌ عَلَيْنَا بَالِغَةٌ اِلٰى يَوْمِ الْقِيٰمَةِۙ اِنَّ لَكُمْ لَمَا تَحْكُمُونَۚ) Yoxsa qiyamət günündə andımıza vəfa edəcəyik və hər bir şey ki, siz istəyirsiniz, sizə verəcəyik deyə siz müşriklərdən ötrü and içib, zamin olmuşuq və o and qiyamətə kimi bizə vacibdir?**

**40) (سَلْهُمْ اَيُّهُمْ بِذٰلِكَ زَعِيمٌۚ)** - (Ey Məhəmməd), **müşriklərdən soruş ki, onların hansı biri bu hökmə zamindir ki, qiyamət günündə müsəlmanlarla bərabər olacaqlar?**

**41) (اَمْ لَهُمْ شُرَكَٓاءُۚ فَلْيَاْتُوا بِشُرَكَٓائِهِمْ اِنْ كَانُوا صَادِقِينَ) Yoxsa onların bu barədə bizə şərik qoşduqları var, hansı ki, axirətdə əcr və savablarının müsəlmanlardan çox, ya da ki, bərabər olmasına hökm edir? Əgər doğru deyirlərsə, şəriklərini gətirsinlər. Belə ki, onlardan ötrü hökm versin.**

**42) (يَوْمَ يُكْشَفُ عَنْ سَاقٍ وَيُدْعَوْنَ اِلَى السُّجُودِ فَلَا يَسْتَطِيعُونَ)** - (Ey Məhəmməd), **elə ki, qiyamət günündə iş çətinləşib, ilahi əzab aşkar olub, qiyamət gününün şiddəti məhşər əhlinə məlum oldu, o zaman insanlar Allah-Təalaya səcdə etməyə dəvət olunarlar.** (Mömin səcdə edib), **müşrik və münafiqlərin beli mis, ya da dəmir kimi quruyub, səcdə etməyə qadir olmazlar.**

**(*Qeyd:** *"Mücəssimə məzhəbi (Allahı cism sahibi sayanlar) bu ayəni əsas götürüb, ayədəki "saq" (baldır) sözünə Allah-Təalanın baldırı mənası verib, o barədə həddən çox mənasız, boş-boş sözlər yazıb, deyiblər ki, Allah-Təala qiyamət günündə baldırını açar, məhşər əhli də hamısı səcdə edər və bu barədə peyğəmbərə elə hədislər isnad ediblər ki, ağıllı şəxslərin qulağı o sözləri eşidəndə kar olar. Mən həqir o uydurma hədisləri nəql etməkdən imtina etdim).*

**43) (خَاشِعَةً اَبْصَارُهُمْ تَرْهَقُهُمْ ذِلَّةٌۜ) - Müşrik və münafiqlərin gözləri zəlilcəsinə aşağı dikilib, özlərini də zillət və həqarət bürüyər. Səcdə edə bilməzlər.**

وَقَدْ كَانُوا يُدْعَوْنَ اِلَى السُّجُودِ وَهُمْ سَالِمُونَ﴿٤٣﴾ فَذَرْنٖي وَمَنْ يُكَذِّبُ بِهٰذَا الْحَدٖيثِۜ
سَنَسْتَدْرِجُهُمْ مِنْ حَيْثُ لَا يَعْلَمُونَۙ ﴿٤٤﴾ وَاُمْلٖي لَهُمْۜ اِنَّ كَيْدٖي مَتٖينٌ ﴿٤٥﴾ اَمْ تَسْـَٔلُهُمْ اَجْرًا
فَهُمْ مِنْ مَغْرَمٍ مُثْقَلُونَۚ ﴿٤٦﴾ اَمْ عِنْدَهُمُ الْغَيْبُ فَهُمْ يَكْتُبُونَ ﴿٤٧﴾

---

**(وَقَدْ كَانُوا يُدْعَوْنَ اِلَى السُّجُودِ وَهُمْ سَالِمُونَ) - Və halbuki həqiqətən, dünyada sağ-salim olduqları zaman peyğəmbərlərin dili ilə Allah-Təalaya səcdə etməyə dəvət olunurdular. Lakin təkəbbürlənib, səcdə etmirdilər. Amma qiyamət günündə səcdə etmək istəyirlər. Lakin onlardan ötrü mümkün olmaz.**

**44) (فَذَرْنٖي وَمَنْ يُكَذِّبُ بِهٰذَا الْحَدٖيثِۜ سَنَسْتَدْرِجُهُمْ مِنْ حَيْثُ لَا يَعْلَمُونَۙ) -** (Ey Məhəmməd), **bu Quranı təkzib edən şəxsləri tərk edib, onların işini mənə həvalə et. Qəlbini onlarla məşğul etməyib, onlardan intiqam almaqda mənə təvəkkül et. Onlar agah olmadıqları halda, yavaş-yavaş onları əzaba yaxınlaşdırıb, qəfildən onlara əzab göndərib həlak edərik. Allah-Təala müşriklərə nemət və bədən sağlığı verdi, nemətin qədrini bilməyib, azğınlıq edib, itaət etmədilər. O nemət səbəbi ilə onlara əzab edilib,** (Bədirdə) **əsir və zəlil olub, öldürüldülər.**

**45) (وَاُمْلٖي لَهُمْۜ اِنَّ كَيْدٖي مَتٖينٌ) -** (Ey Məhəmməd), **müşriklərin nemətlərini çox və firavan, ömürlərini uzun edib, onlara möhlət verərəm. Nemətə şükür etmək əvəzinə daha da tüğyan edib, onların fəlakətə düşməsinə səbəb olar.** (Ey Məhəmməd), **həqiqətən, mənim yaxşılığım və nemətim onların tüğyanlarına görə fəlakətlərinə səbəb olduqda, hiylə və məkr surətində olub son dərəcə şiddətli və möhkəmdir, heç vaxt əzabdan xilas olmayacaqlar.**

**46) (اَمْ تَسْـَٔلُهُمْ اَجْرًا فَهُمْ مِنْ مَغْرَمٍ مُثْقَلُونَۚ) -** (Ey Məhəmməd), **bəs məgər sən onlardan peyğəmbərliyi* təbliğə görə əcr və muzd istəyirsən ki, onlara borc ödəmək ağır gəlib, iman etmələrinə mane olsun. Sən ki, onlardan bir şey istəmirsən. Bəs niyə iman etmirlər?**

**(*Qeyd:** *“Həqiqətən din ehkamını xalqa çatdırıb, nəsihət və vəz etmək üçün əcr, muzd istəmək insanların itaətsizliyinə və nəsihət edənin sözünün təsirinə böyük maneədir. Müsəlman vaizlərinin və nəsihətçilərinin sözlərinin təsir etməməsi həmin əcr və muzd məsələsindən və “qənaət edən izzətli olar və tamahkarlıq edən zəlil olar” sözünü unutmalarından qaynaqlanır”).*

**47) (اَمْ عِنْدَهُمُ الْغَيْبُ فَهُمْ يَكْتُبُونَ) Yoxsa müşriklərin yanında qeyb elmi var, hansı ki, özlərindən ötrü istədiklərini hökm edib, yazırlar?**

فَاصْبِرْ لِحُكْمِ رَبِّكَ وَلَا تَكُنْ كَصَاحِبِ الْحُوتِۢ اِذْ نَادٰى وَهُوَ مَكْظُومٌۜ ﴿٤٨﴾ لَوْلَٓا اَنْ تَدَارَكَهُ نِعْمَةٌ
مِنْ رَبِّهٖ لَنُبِذَ بِالْعَرَٓاءِ وَهُوَ مَذْمُومٌ ﴿٤٩﴾ فَاجْتَبٰيهُ رَبُّهُ فَجَعَلَهُ مِنَ الصَّالِحِينَ ﴿٥٠﴾ وَاِنْ يَكَادُ
الَّذِينَ كَفَرُوا لَيُزْلِقُونَكَ بِاَبْصَارِهِمْ لَمَّا سَمِعُوا الذِّكْرَ وَيَقُولُونَ اِنَّهُ لَمَجْنُونٌۢ ﴿٥١﴾ وَمَا هُوَ اِلَّا ذِكْرٌ
لِلْعَالَمِينَ ﴿٥٢﴾

---

**48) (فَاصْبِرْ لِحُكْمِ رَبِّكَ وَلَا تَكُنْ كَصَاحِبِ الْحُوتِۢ اِذْ نَادٰى وَهُوَ مَكْظُومٌ) -** (Ey Məhəmməd), **müşriklərə möhlət verib, onların əzabını təxirə salmaqda rəbbin Allah-Təalanın hökmünün intizarında səbir edib, balıq sahibi** (Yunis ibn Mətta) **kimi olma. O zaman ki, qövmünə əzab gəlməsinə səbir etməyib, onların arasından gedib, balığın qarnına düşdü. Qəzəbli olduğu halda balığın qarnında Allah-Təalanı çağırıb dua etdi.**

**49) (لَوْلَٓا اَنْ تَدَارَكَهُ نِعْمَةٌ مِنْ رَبِّهٖ لَنُبِذَ بِالْعَرَٓاءِ وَهُوَ مَذْمُومٌ) -** (Ey Məhəmməd), **əgər** (Yunisin) **rəbbi Allah-Təalanın neməti ona gəlməyib, tövbə ona qismət olmasaydı, hər halda bizim tərəfimizdən məzəmmət olunduğu halda balığın qarnından səhraya atılardı.**

**50) (فَاجْتَبٰيهُ رَبُّهُ فَجَعَلَهُ مِنَ الصَّالِحِينَ) Lakin tövbə səbəbinə rəbbi Allah-Təala** (Yunisi) **seçib, vəhy və peyğəmbərliyi ondan almayıb, salehlərdən etdi.**

**51) (وَاِنْ يَكَادُ الَّذِينَ كَفَرُوا لَيُزْلِقُونَكَ بِاَبْصَارِهِمْ لَمَّا سَمِعُوا الذِّكْرَ وَيَقُولُونَ اِنَّهُ لَمَجْنُونٌۢ) -** (Ey Məhəmməd), **o zaman ki, müşriklər Quranı eşidirdilər, ədavətlərinin şiddətindən və sənə qeyzlə, qəzəblə baxmalarından az qalırdı ki, səni yerindən çıxarıb, həlak etsinlər. Sənə qəzəblə elə baxırdılar ki, guya səni gözləri ilə həlak etmək istəyirlər və həm də deyirdilər ki, o, dəlidir.**

**52) (وَمَا هُوَ اِلَّا ذِكْرٌ لِلْعَالَمِينَ) -** (Ey Məhəmməd), **Qurana görə sənə dəli deyirdilər, halbuki bu Quran** (əgər fikir versələr, görərlər ki,) **bütün aləmlərdən ötrü nəsihətdən başqa bir şey deyil. Belə kəlamı gətirən şəxsə necə dəli demək olar? Müşriklərin sənə dəli deməsi ancaq ədavət və inadları səbəbi ilədir.**

Allaha həmd olsun, Nun surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: "Kim Nun surəsini oxusa, Allah-Təala ona gözəl əxlaq sahibinin savabını bəxş edər".

## əl-HAQQƏ SURƏSİ

69-cu surədir. Məkkədə nazil olub, 51 ayə, 256 kəlmə və 1034 hərfdir.

اَلْحَاقَّةُ ﴿١﴾ مَا الْحَاقَّةُ ﴿٢﴾ وَمَٓا اَدْرٰيكَ مَا الْحَاقَّةُ ﴿٣﴾ كَذَّبَتْ ثَمُودُ وَعَادٌ بِالْقَارِعَةِ ﴿٤﴾ فَاَمَّا
ثَمُودُ فَاُهْلِكُوا بِالطَّاغِيَةِ﴿٥﴾ وَاَمَّا عَادٌ فَاُهْلِكُوا بِرِيحٍ صَرْصَرٍ عَاتِيَةٍ﴿٦﴾ سَخَّرَهَا عَلَيْهِمْ سَبْعَ لَيَالٍ
وَثَمَانِيَةَ اَيَّامٍ حُسُومًا فَتَرَى الْقَوْمَ فِيهَا صَرْعٰى كَاَنَّهُمْ اَعْجَازُ نَخْلٍ خَاوِيَةٍ ﴿٧﴾ فَهَلْ تَرٰى لَهُمْ مِنْ
بَاقِيَةٍ ﴿٨﴾ وَجَٓاءَ فِرْعَوْنُ وَمَنْ قَبْلَهُ وَالْمُؤْتَفِكَاتُ بِالْخَاطِئَةِ ﴿٩﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (اَلْحَاقَّةُ)** - (Ey Məhəmməd), **qiyamət gününün vaqe olması vacibdir. O günün gəlməsi haqq və sabitdir, onda heç bir şəkk və şübhə yoxdur.**

**2) ( مَا الْحَاقَّةُ) Qiyamət gününün əsli və həqiqəti nədir?.**

**3) (وَمَٓا اَدْرٰيكَ مَا الْحَاقَّةُ)** - (Ey Məhəmməd), **qiyamətin əslini və həqiqətini sənə kim bildiribdir? Onun əsl həqiqəti və əzəməti haqqında sənin elmin yoxdur və heç kimin də o haqda bilgisi də yoxdur. Onun halını necə təsəvvür etsən də ondan artıqdır.**

**4) ( كَذَّبَتْ ثَمُودُ وَعَادٌ بِالْقَارِعَةِ) - Bütün varlığı dəhşətə və qorxuya salıb, əzən** (qiyamət) **gününü Ad və Səmud camaatı təkzib etdilər.**

**5) (فَاَمَّا ثَمُودُ فَاُهْلِكُوا بِالطَّاغِيَةِ) Amma Səmud camaatı şiddət və dəhşətdə həddi aşan bir əzabla həlak oldular.**

**6) ( وَاَمَّا عَادٌ فَاُهْلِكُوا بِرِيحٍ صَرْصَرٍ عَاتِيَةٍ) Amma Ad camaatı inadkar və şiddətli hərəkət edən bir küləklə həlak oldular.**

**7) (سَخَّرَهَا عَلَيْهِمْ سَبْعَ لَيَالٍ وَثَمَانِيَةَ اَيَّامٍ حُسُومًا) Allah-Təala yeddi gecə və səkkiz gün dalbadal, bir an da dayanmayan küləyi onların üzərinə əsdirib, onları özünə tabe etdi.**

**( فَتَرَى الْقَوْمَ فِيهَا صَرْعٰى كَاَنَّهُمْ اَعْجَازُ نَخْلٍ خَاوِيَةٍ)** - (Ey Məhəmməd), **əgər orada olsaydın, hər halda orada Ad camaatının xurma ağacının dənəsi kimi yerə yıxılıb həlak olduğunu görərdin.**

**8) ( فَهَلْ تَرٰى لَهُمْ مِنْ بَاقِيَةٍ) - Bəs onlardan sağ qalan birini görürsənmi?**

**9) (وَجَٓاءَ فِرْعَوْنُ وَمَنْ قَبْلَهُ وَالْمُؤْتَفِكَاتُ بِالْخَاطِئَةِ) Firon, ondan əvvəlkilər və Mötəfikə əhli** (Lut peyğəmbərin camaatı) **böyük xəta edib müşrik oldular.**

فَعَصَوْا رَسُولَ رَبِّهِمْ فَاَخَذَهُمْ اَخْذَةً رَابِيَةً ﴿١٠﴾ اِنَّا لَمَّا طَغَا الْمَآءُ حَمَلْنَاكُمْ فِي الْجَارِيَةِ ﴿١١﴾ لِنَجْعَلَهَا لَكُمْ تَذْكِرَةً وَتَعِيَهَآ اُذُنٌ وَاعِيَةٌ ﴿١٢﴾ فَاِذَا نُفِخَ فِي الصُّورِ نَفْخَةٌ وَاحِدَةٌ ﴿١٣﴾ وَحُمِلَتِ الْاَرْضُ وَالْجِبَالُ فَدُكَّتَا دَكَّةً وَاحِدَةً﴿١٤﴾ فَيَوْمَئِذٍ وَقَعَتِ الْوَاقِعَةُ ﴿١٥﴾ وَانْشَقَّتِ السَّمَآءُ فَهِيَ يَوْمَئِذٍ وَاهِيَةٌ ﴿١٦﴾ وَالْمَلَكُ عَلٰى اَرْجَآئِهَا وَيَحْمِلُ عَرْشَ رَبِّكَ فَوْقَهُمْ يَوْمَئِذٍ ثَمَانِيَةٌ ﴿١٧﴾

---

**10) (**فَعَصَوْا رَسُولَ رَبِّهِمْ فَاَخَذَهُمْ اَخْذَةً رَابِيَةً**) - Öz rəbləri Allah-Təalanın peyğəmbərinə asi oldular və bu səbəbdən Allah-Təala onları son dərəcə şiddətli əzaba düçar edib hamısını həlak etdi.**

**11) (**اِنَّا لَمَّا طَغَا الْمَآءُ حَمَلْنَاكُمْ فِي الْجَارِيَةِ**) - O zaman ki,** (Nuh qövmünə əzab gəlib), **su hər bir tərəfdən tüğyan etdi, sizi gəmidəki atalarınızın belində gəmiyə daşıyıb, nicat verdik.**

**12) (**لِنَجْعَلَهَا لَكُمْ تَذْكِرَةً وَتَعِيَهَآ اُذُنٌ وَاعِيَةٌ**) Ta ki, o nicatı sizdən ötrü nəsihət və ibrət edib və hər bir diqqət edib yadda saxlayan qulaq onu eşidib saxlasın.** (Zəməxşəri "Kəşşaf"da belə deyir: "Bu ayə nazil olandan sonra peyğəmbər (ə.s) Əliyə (ə.s) dedi: "Ey Əli, Allah-Təaladan sənin qulağını diqqətli eşidən və yadda saxlayan qulaq etməsini istədim. Əli deyir: "Ondan sonra eşitdiyim heç bir sözü unutmadım).

**13) (**فَاِذَا نُفِخَ فِي الصُّورِ نَفْخَةٌ وَاحِدَةٌ**)** - (Ey Məhəmməd), **o zaman ki, surətlərə bir dəfə** (ilk dəfə) **üfürülüb həlak oldular.**

**14) (**وَحُمِلَتِ الْاَرْضُ وَالْجِبَالُ فَدُكَّتَا دَكَّةً وَاحِدَةً**) Yer və dağlar qaldırılıb, bircə dəfə bir-birinə çırpılıb hamısı məhv oldu.**

**15) (**فَيَوْمَئِذٍ وَقَعَتِ الْوَاقِعَةُ**) - Ogünkü gündə vaqe olması vacib olan qiyamət günü vaqe olar.** (Ayə kürələrin bir-birinə toxunub dağılmasına dəlildir).

**16) (**وَانْشَقَّتِ السَّمَآءُ فَهِيَ يَوْمَئِذٍ وَاهِيَةٌ**) Göy yarılıb, parçalanıb, aləm də dəyişər.** (Ruh sahiblərinin həyatının davamına bais olan havanın ünsürləri dəyişib, öldürücü olub, istilik artar), **bundan sonra ruh sahiblərinin yaşaması mümkün olmaz.**

**17) (**وَالْمَلَكُ عَلٰى اَرْجَآئِهَا وَيَحْمِلُ عَرْشَ رَبِّكَ فَوْقَهُمْ يَوْمَئِذٍ ثَمَانِيَةٌ**) - Mələklər səmanın ətrafında Allah-Təalanın əmrini gözləyib, müntəzir olarlar.** (Ey Məhəmməd), **qiyamət günündə sənin rəbbin Allah-Təalanın* ərşini** (taxtını) **üstündəki səkkiz mələk daşıyar.**

**(*Qeyd:** *"Allah-Təala qiyamət günündə özünün əmr sahibi olmasını, dünyada taxt-tac sahibi və rəiyyətə hakim olan sultana oxşadır və özündən ötrü taxt ifadəsini işlədir. O hədis ki, ərşin hər birini bir heyvan surətində səkkiz canlının daşıdığını bəyan edir, bu mətləbə işarədir, necə ki, dünyada sultanların taxtını*

يَوْمَئِذٍ تُعْرَضُونَ لَا تَخْفٰى مِنْكُمْ خَافِيَةٌ ﴿١٨﴾ فَاَمَّا مَنْ اُو۫تِيَ كِتَابَهُ بِيَم۪ينِه۪ فَيَقُولُ هَٓاؤُ۬مُ اقْرَؤُ۫ا كِتَابِيَهْۚ
﴿١٩﴾ اِنّ۪ي ظَنَنْتُ اَنّ۪ي مُلَاقٍ حِسَابِيَهْۚ ﴿٢٠﴾ فَهُوَ ف۪ي ع۪يشَةٍ رَاضِيَةٍۙ ﴿٢١﴾ ف۪ي جَنَّةٍ عَالِيَةٍۙ ﴿٢٢﴾
قُطُوفُهَا دَانِيَةٌ ﴿٢٣﴾ كُلُوا وَاشْرَبُوا هَن۪ٓيـًٔا بِمَٓا اَسْلَفْتُمْ فِي الْاَيَّامِ الْخَالِيَةِ ﴿٢٤﴾ وَاَمَّا مَنْ اُو۫تِيَ كِتَابَهُ
بِشِمَالِه۪ فَيَقُولُ يَا لَيْتَن۪ي لَمْ اُو۫تَ كِتَابِيَهْۚ ﴿٢٥﴾ وَلَمْ اَدْرِ مَا حِسَابِيَهْۚ ﴿٢٦﴾

---

*daş, mis, bürünc və ya digər şeylərdən şir və digər vəhşi heyvanların heykəllərinin üstündə düzəldirdilər, Allah-Təalanın da Qurani-Şərifdə adət-ənənə üzrə danışması məxfi olmayıb günəş kimi açıq-aydındır).*

**18) (يَوْمَئِذٍ تُعْرَضُونَ لَا تَخْفٰى مِنْكُمْ خَافِيَةٌ) Elə gündə** (qiyamət günündə) **haqq-hesabdan ötrü mütləq qadir olanın hüzurunda hazır olarsınız, dünyada məxfi saxladığınız işlərdən heç biri** (Allaha) **gizli qalmayıb, hamısı qiyamət günündə məlum olar.**

**19) (فَاَمَّا مَنْ اُو۫تِيَ كِتَابَهُ بِيَم۪ينِه۪ فَيَقُولُ هَٓاؤُ۬مُ اقْرَؤُ۫ا كِتَابِيَهْ) Amma o şəxs ki, qiyamət günündə onun kağızı sağ əlinə verilib, nicat tapmasına tam inanar, fərəh və sevincindən yaxın qohum-əqrəbasını çağırıb deyər: "Gəlin, mənim kağızımı oxuyub görək, Allah-Təala məndən ötrü necə xeyir əməllər qeyd edib saxlayıbdır?**

**20) (اِنّ۪ي ظَنَنْتُ اَنّ۪ي مُلَاقٍ حِسَابِيَهْ) Həqiqətən, mən dünyada olduğum zaman axirətdə haqq-hesabımla qarşılaşacağıma inanmışdım və bu səbəbdən xeyir əmələ yönəldim. Allah-Təala da həmin xeyir əməlləri məndən ötrü qoruyub saxladı.**

**21-22) (فَهُوَ ف۪ي ع۪يشَةٍ رَاضِيَةٍۙ ف۪ي جَنَّةٍ عَالِيَةٍۙ)** - (Ey Məhəmməd), **belə şəxs uca cənnətdə razı qaldığı eyş və işrət içində olar.**

**23) ( قُطُوفُهَا دَانِيَةٌ) - O cənnətin meyvələrini dərmək, əyləşib ayaqüstə duranın hər ikisinə də yaxın və bərabər olub, asan şəkildə onu dərərlər.**

**24) (كُلُوا وَاشْرَبُوا هَن۪ٓيـًٔا بِمَٓا اَسْلَفْتُمْ فِي الْاَيَّامِ الْخَالِيَةِ) - Bizim tərəfimizdən onlara deyilər: "Dünyada əvvəlcədən göndərdiyiniz xeyir əməllərə görə indi sizin üçün dadlı olan hər bir nemətdən yeyib içib, rahat olun.**

**25) (وَاَمَّا مَنْ اُو۫تِيَ كِتَابَهُ بِشِمَالِه۪ فَيَقُولُ يَا لَيْتَن۪ي لَمْ اُو۫تَ كِتَابِيَهْ) Amma o şəxs ki,** (günahkar olub) **onun kağızı sol əlinə verilər, əzaba düçar olacağına qəti inanıb, təəssüf və peşmançılıqla deyər: "Kaş kağızım mənə verilməyib, onda yazılan sözlərə agah olmayaydım.**

**26) (وَلَمْ اَدْرِ مَا حِسَابِيَهْۚ) Kaş haqq-hesabımın nə və necə olmasına agah olmayaydım.**

يَا لَيْتَهَا كَانَتِ الْقَاضِيَةَۚ ﴿٢٧﴾ مَٓا اَغْنٰى عَنّ۪ي مَالِيَهْۚ ﴿٢٨﴾ هَلَكَ عَنّ۪ي سُلْطَانِيَهْۚ ﴿٢٩﴾ خُذُوهُ فَغُلُّوهُ
ۙ﴿٣٠﴾ ثُمَّ الْجَح۪يمَ صَلُّوهُ ۙ﴿٣١﴾ ثُمَّ ف۪ي سِلْسِلَةٍ ذَرْعُهَا سَبْعُونَ ذِرَاعًا فَاسْلُكُوهُۜ ﴿٣٢﴾ اِنَّهُ كَانَ
لَا يُؤْمِنُ بِاللّٰهِ الْعَظ۪يمِۙ ﴿٣٣﴾ وَلَا يَحُضُّ عَلٰى طَعَامِ الْمِسْك۪ينِۜ ﴿٣٤﴾ فَلَيْسَ لَهُ الْيَوْمَ هٰهُنَا حَم۪يمٌ
ۙ﴿٣٥﴾ وَلَا طَعَامٌ اِلَّا مِنْ غِسْل۪ينٍۙ ﴿٣٦﴾ لَا يَاْكُلُهُٓ اِلَّا الْخَاطِؤُ۫نَ۟ ﴿٣٧﴾ فَلَٓا اُقْسِمُ بِمَا تُبْصِرُونَ
ۙ﴿٣٨﴾ وَمَا لَا تُبْصِرُونَۙ ﴿٣٩﴾ اِنَّهُ لَقَوْلُ رَسُولٍ كَر۪يمٍۚ ﴿٤٠﴾

---

**27) (يَا لَيْتَهَا كَانَتِ الْقَاضِيَةَ) Kaş dünyada ölüm məni birdəfəlik yox edib, yenidən dirilməyəydim.**

**28) (مَٓا اَغْنٰى عَنّ۪ي مَالِيَهْ) - Mal-dövlətim mənə bir fayda verməyib, əzabı məndən dəf etmədi.**

**29) (هَلَكَ عَنّ۪ي سُلْطَانِيَهْ) - İnsanlara hakim olmağım boşa getdi. Yoxsulluq və zillət içində qaldım, indi mənə rəhm edən də yoxdur.**

**30-31) (خُذُوهُ فَغُلُّوهُ ثُمَّ الْجَح۪يمَ صَلُّوهُ)** - (Ey Məhəmməd), **bizim tərəfimizdən cəhənnəm mühafizlərinə əmr olunar: “Bu fasiq və asi şəxsi tutub əllərini boynuna bağlayıb, ondan sonra onu cəhənnəmin böyük alovuna atın.**

**32-33) (ثُمَّ ف۪ي سِلْسِلَةٍ ذَرْعُهَا سَبْعُونَ ذِرَاعًا فَاسْلُكُوهُ) - Ondan sonra yetmiş arşın qədər olan zəncirlə onu bağlayıb əzab edin. (اِنَّهُ كَانَ لَا يُؤْمِنُ بِاللّٰهِ الْعَظ۪يمِ) Həqiqətən, bu şəxs əzəmət və qüdrət sahibi olan Allah-Təalaya dünyada iman etməyib, onun birliyini iqrar etmədi.** (Ayədəki yetmiş rəqəmi məsəl çəkməkdən ötrüdür, necə ki, Quranın digər yerlərində də qeyd olunubdur).

**34) (وَلَا يَحُضُّ عَلٰى طَعَامِ الْمِسْك۪ينِ) - Və yoxsulları yedizdirməyi təşviq etmirdi.** (Yoxsulu yedirməyi təşviq etməyənə belə əzab ediləndə, gör, imkanı olduğu halda yoxsulu yedirməyənə necə əzab olunacaqdır?)

**35) (فَلَيْسَ لَهُ الْيَوْمَ هٰهُنَا حَم۪يمٌ)** - (Ey Məhəmməd), **belə şəxsdən ötrü o gündə** (qiyamət günündə) **yaxın qohum-əqrəbasından bir nəfər olmaz ki, qəlbi ona yanıb, əzabı ondan dəf etsin.**

**36) (وَلَا طَعَامٌ اِلَّا مِنْ غِسْل۪ينٍ) - Və ona cəhənnəm əhlinin bədənindən axan qan və çirkli irindən başqa yemək təklif olunmaz.**

**37) (لَا يَاْكُلُهُٓ اِلَّا الْخَاطِؤُ۫نَ) - O qanı və çirkli irini xəta və böyük günah sahiblərindən (müşriklər və tövbəsiz dünyadan gedən böyük günah sahibləri) başqası yeməz.**

**38-39-40) (فَلَٓا اُقْسِمُ بِمَا تُبْصِرُونَ وَمَا لَا تُبْصِرُونَ اِنَّهُ لَقَوْلُ رَسُولٍ كَر۪يمٍ) - Müşriklərin Quran haqqında danışıb, onu batil zənn etdiyi kimi deyil. And içirəm o şeylərə ki, siz onu görürsünüz və o şeylərə ki, onu görmürsünüz.**

وَمَا هُوَ بِقَوْلِ شَاعِرٍۜ قَلٖيلًا مَا تُؤْمِنُونَۙ ﴿٤١﴾ وَلَا بِقَوْلِ كَاهِنٍۜ قَلٖيلًا مَا تَذَكَّرُونَۜ ﴿٤٢﴾ تَنْزٖيلٌ
مِنْ رَبِّ الْعَالَمٖينَ ﴿٤٣﴾ وَلَوْ تَقَوَّلَ عَلَيْنَا بَعْضَ الْاَقَاوٖيلِۙ ﴿٤٤﴾ لَاَخَذْنَا مِنْهُ بِالْيَمٖينِۙ ﴿٤٥﴾ ثُمَّ
لَقَطَعْنَا مِنْهُ الْوَتٖينَۘ ﴿٤٦﴾ فَمَا مِنْكُمْ مِنْ اَحَدٍ عَنْهُ حَاجِزٖينَ﴿٤٧﴾ وَاِنَّهُ لَتَذْكِرَةٌ لِلْمُتَّقٖينَ ﴿٤٨﴾
وَاِنَّا لَنَعْلَمُ اَنَّ مِنْكُمْ مُكَذِّبٖينَ ﴿٤٩﴾ وَاِنَّهُ لَحَسْرَةٌ عَلَى الْكَافِرٖينَ ﴿٥٠﴾ وَاِنَّهُ لَحَقُّ الْيَقٖينِ ﴿٥١﴾
فَسَبِّحْ بِاسْمِ رَبِّكَ الْعَظٖيمِ ﴿٥٢﴾

---

**Həqiqətən, bu Quran bizim tərəfimizdən göndərilən əziz və möhtərəm bir peyğəmbərin sözüdür.**

**41) (وَمَا هُوَ بِقَوْلِ شَاعِرٍۜ قَلٖيلًا مَا تُؤْمِنُونَۙ) - Bu Quran** (necə ki, deyirsiniz), **şair sözü deyildir, lakin şair sözü olmayıb, Allah-Təalanın sözü olduğuna sizdən çox az insan iman edir.**

**42) (وَلَا بِقَوْلِ كَاهِنٍۜ قَلٖيلًا مَا تَذَكَّرُونَۜ)** (Necə ki, siz deyirsiniz), **bu Quran falçı sözü deyildir, lakin sizdən çox az insan agah olub, Quranın haqq olmağını dərk edir.**

**43) (تَنْزٖيلٌ مِنْ رَبِّ الْعَالَمٖينَ) - Əksinə bu Quran aləmlərə tərbiyə verən rəbb Allah-Təaladan nazil olubdur.**

**44-45) ( وَلَوْ تَقَوَّلَ عَلَيْنَا بَعْضَ الْاَقَاوٖيلِۙ لَاَخَذْنَا مِنْهُ بِالْيَمٖينِۙ) - Əgər bu** (Məhəmməd), **özündən bəzi sözlər düzəldib, bizə iftira etsə, hər halda biz qüvvə və qüdrətimizlə onu sağ tərəfindən tutarıq.**

**46) (ثُمَّ لَقَطَعْنَا مِنْهُ الْوَتٖينَۘ) - Ondan sonra onun qəlbinə gedən şah damarını qopararıq, o anda həlak olar.**

**47) (فَمَا مِنْكُمْ مِنْ اَحَدٍ عَنْهُ حَاجِزٖينَ) Belə vaxtda əgər siz** (Məhəmmədə) **kömək etmək istəsəniz də, sizdən heç kim ona kömək edib, əzabımızı ondan dəf edə bilməz.**

**48) (وَاِنَّهُ لَتَذْكِرَةٌ لِلْمُتَّقٖينَ) Həqiqətən, bu Quran müttəqilərdən ötrü öyüd-nəsihətdir, inadkarlar ondan faydalana bilməzlər.**

**49) (وَاِنَّا لَنَعْلَمُ اَنَّ مِنْكُمْ مُكَذِّبٖينَ) Həqiqətən, sizlərdən Quranı təkzib edənlərdən əlbəttə biz agahıq və onlara təkzib etmələrinin cəzasını verəcəyik.**

**50) ( وَاِنَّهُ لَحَسْرَةٌ عَلَى الْكَافِرٖينَ) - Və həqiqətən, bu Quran** (qiyamət günündə onu təsdiq edənlərin savabını görəndə) **kafirlər üçün peşmançılıq olub, onu təkzib etdikləri üçün təəssüf edərlər.**

**51) (وَاِنَّهُ لَحَقُّ الْيَقٖينِ) - Və həqiqətən, Quran** (təfəkkür edənlərdən ötrü) **haqq və xalis inamdır. Onda heç bir şəkk və şübhə yoxdur.**

**52) (فَسَبِّحْ بِاسْمِ رَبِّكَ الْعَظٖيمِ)** - (Ey Məhəmməd), **rəbbin Allah-Təalanın bö-**

**yük adını zikr etməklə onu təqdis edib, uca sayıb, səni peyğəmbərliyə layiq etdiyi üçün şükür edərək ona ibadət et.**

Allaha həmd olsun, əl-Haqqə surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdur: "Kim əl-Haqqə surəsini oxusa, Allah-Təala qiyamət günündə onun haqq-hesabını asan edər.

## əl-MƏARİC SURƏSİ

70-ci surədir. Məkkədə nazil olub, 44 ayə, 214 kəlmə və 929 hərfdir.

سَالَ سَٓائِلٌ بِعَذَابٍ وَاقِعٍۙ ﴿١﴾ لِلْكَافِر۪ينَ لَيْسَ لَهُ دَافِعٌۙ ﴿٢﴾ مِنَ اللّٰهِ ذِي الْمَعَارِجِۜ ﴿٣﴾ تَعْرُجُ
الْمَلٰٓئِكَةُ وَالرُّوحُ اِلَيْهِ ف۪ي يَوْمٍ كَانَ مِقْدَارُهُ خَمْس۪ينَ اَلْفَ سَنَةٍۚ ﴿٤﴾ فَاصْبِرْ صَبْرًا جَم۪يلًا ﴿٥﴾ اِنَّهُمْ
يَرَوْنَهُ بَع۪يدًاۙ ﴿٦﴾ وَنَرٰيهُ قَر۪يبًاۜ ﴿٧﴾ يَوْمَ تَكُونُ السَّمَٓاءُ كَالْمُهْلِۙ ﴿٨﴾ وَتَكُونُ الْجِبَالُ كَالْعِهْنِۙ ﴿٩﴾

---

### Bismillahir-Rəhmanir-Rəhim

(O zaman ki, peyğəmbər Məkkə əhlini Allah-Təalanın əzabı ilə qorxutdu, onlar bir-birilərinə dedilər: "Görəsən, bu əzab kimdən ötrüdür?" Gedək, Məhəmməddən soruşaq. Elə ki, peyğəmbərdən soruşdular, o vaxt da bu mübarək surə nazil oldu).

**1)** (سَالَ سَٓائِلٌ بِعَذَابٍ وَاقِعٍۙ) - (Ey Məhəmməd), **biri səndən axirət əzabını soruşdu. Hansı ki, o əzab vaqe olacaqdır və onun vaqe olmasına heç bir şəkk və şübhə yoxdur.**

**2)** (لِلْكَافِر۪ينَ لَيْسَ لَهُ دَافِعٌ) **- O əzab kafirlərdən ötrüdür, hər halda, vaqe olacaq, heç bir şəxs onu dəf edə bilməz.**

**3)** (مِنَ اللّٰهِ ذِي الْمَعَارِجِۜ) **Uca mərtəbəli dərəcələr sahibi Allah-Təaladan olan əzab kafirlərə vaqe olacaqdır.**

**4)** (تَعْرُجُ الْمَلٰٓئِكَةُ وَالرُّوحُ اِلَيْهِ ف۪ي يَوْمٍ كَانَ مِقْدَارُهُ خَمْس۪ينَ اَلْفَ سَنَةٍۚ) **- Bir gün ki,** (qiyamət günü), **onun miqdarı əlli min dünya ilinin miqdarı qədərdir, elə gündə mələklər və Cəbrayıl Allah-Təalanın dərgahına tərəf qalxıb qiyamətə aid olan ehkamı qəbul edəcəklər.**

**5)** (فَاصْبِرْ صَبْرًا جَم۪يلًا) - (Ey Məhəmməd), **müşriklərin səni təkzib etməsinə gözəl şəkildə səbir et, əlbəttə onlara dünya və axirətdə əzab vaqe olacaqdır.**

**6-7)** ( اِنَّهُمْ يَرَوْنَهُ بَع۪يدًاۙ وَنَرٰيهُ قَر۪يبًاۜ ) - (Ey Məhəmməd), **müşriklər əzabın vaqe olmasını uzaq** (bir ehtimal) **və imkansız görürlər, amma biz onu yaxın və qüdrətimiz üçün asan görürük.**

**8-9)** (يَوْمَ تَكُونُ السَّمَٓاءُ كَالْمُهْلِۙ وَتَكُونُ الْجِبَالُ كَالْعِهْنِۙ) **Qiyamət günü elə bir gündür ki, o gündə səma istiliyin şiddətindən zeytun yağının xıltı kimi görünüb, dağlar rəngarəng yun kimi görünərlər.**

وَلَا يَسْـَٔلُ حَمِيمٌ حَمِيمًاۚ ﴿١٠﴾ يُبَصَّرُونَهُمْۜ يَوَدُّ الْمُجْرِمُ لَوْ يَفْتَدِي مِنْ عَذَابِ يَوْمِئِذٍ بِبَنِيهِۙ ﴿١١﴾
وَصَاحِبَتِهِ وَاَخِيهِۙ ﴿١٢﴾ وَفَصِيلَتِهِ الَّتِي تُـْٔوِيهِۙ ﴿١٣﴾ وَمَنْ فِي الْاَرْضِ جَمِيعًاۙ ثُمَّ يُنْجِيهِۙ ﴿١٤﴾ كَلَّاۜ
اِنَّهَا لَظٰىۙ ﴿١٥﴾ نَزَّاعَةً لِلشَّوٰىۚ ﴿١٦﴾ تَدْعُوا مَنْ اَدْبَرَ وَتَوَلّٰىۙ ﴿١٧﴾ وَجَمَعَ فَاَوْعٰى ﴿١٨﴾ اِنَّ
الْاِنْسَانَ خُلِقَ هَلُوعًاۙ ﴿١٩﴾ اِذَا مَسَّهُ الشَّرُّ جَزُوعًاۙ ﴿٢٠﴾ وَاِذَا مَسَّهُ الْخَيْرُ مَنُوعًاۙ ﴿٢١﴾

---

**10) (وَلَا يَسْـَٔلُ حَمِيمٌ حَمِيمًاۚ) - O gün qohum öz qohumunun halını soruşmayıb, hər kəs özü ilə məşğul olar.**

**11-13) (يُبَصَّرُونَهُمْۜ) Elə deyil ki, yaxın qohumlar bir-birini görməyib, o səbəbdən bir-birlərinin əhvalını soruşmurlar. Əksinə bir-birlərini görüb tanıyırlar, lakin özləri ilə məşğul olmaqdan digərlərini unudarlar.**

**(يَوَدُّ الْمُجْرِمُ لَوْ يَفْتَدِي مِنْ عَذَابِ يَوْمِئِذٍ بِبَنِيهِۙ)** - (Ey Məhəmməd), **qiyamət günündə günahkar şəxs özünə yoldaş axtarar ki, kaş o günün əzabı üçün (bundan sonra qeyd olunan şəxsləri) öz yerinə əvəz verib, özü xilas olsun, oğlanlarını, (وَصَاحِبَتِهِ) xanımını, (وَاَخِيهِۙ) qardaşını, (وَفَصِيلَتِهِ الَّتِي تُـْٔوِيهِۙ) elə yaxın qohum-əqrəbasını, hansı ki, hər bir bəla və müsibətdə onlara pənah aparıb, onlar ona kömək olub, mənzil və sığınacaq verirdilər.**

**14) (وَمَنْ فِي الْاَرْضِ جَمِيعًاۙ) Yer üzündə olan bütün məxluqları,**

**(ثُمَّ يُنْجِيهِۙ) günahkar şəxs özünə dost edər ki, bu qeyd olunan şəxslərin hamısını öz yerinə əvəz verib, ondan sonra özünü qurtarsın.**

**15) (كَلَّاۜ اِنَّهَا لَظٰىۙ) Yox, heç bir şey asi və günahkara əzabdan nicat verməz. Cəhənnəmin odu alovlu bir atəşdir.**

**16) (نَزَّاعَةً لِلشَّوٰىۚ) - O od insanın əl-ayağının cildini və ətini yandırıb, əti sümükdən ayıran oddur.**

**17) (تَدْعُوا مَنْ اَدْبَرَ وَتَوَلّٰىۙ) Hər o şəxs ki, haqqa arxa çevirib, üz döndərir, cəhənnəm onu öz yanına çağırar.**

**18) (وَجَمَعَ فَاَوْعٰى) - Və hər o şəxs ki, dünya malını yığıb, xəzinə toplayıb, Allah-Təalanın yolunda, din və millətinin ehtiyacı üçün sərf etmir, belə şəxsləri də cəhənnəm çağırıb deyər: "Mənim tərəfimə gəlin, sizin mənziliniz gərək burda olsun.** (Bu ayə dünya malını yığıb, millətin ehtiyacları yolunda sərf etməyən varlılara xəbərdarlıqdır).

**19) (اِنَّ الْاِنْسَانَ خُلِقَ هَلُوعًاۙ)** - (Ey Məhəmməd), **həqiqətən, insan səbirsiz və həris yaradılıbdır.**

**20-21) (اِذَا مَسَّهُ الشَّرُّ جَزُوعًاۙ وَاِذَا مَسَّهُ الْخَيْرُ مَنُوعًاۙ) - O zaman ki, insana* bir bəla və müsibət gəldi, səbir etməyib, ah-nalə edər və o zaman ki, ona bir xeyir gəldi, xəsislik edib xərcləməyə mane olar.**

اِلَّا الْمُصَلّ۪ينَۙ ﴿٢٢﴾ اَلَّذ۪ينَ هُمْ عَلٰى صَلَاتِهِمْ دَٓائِمُونَۖ ﴿٢٣﴾ وَالَّذ۪ينَ ف۪ٓي اَمْوَالِهِمْ حَقٌّ مَعْلُومٌۙ
﴿٢٤﴾ لِلسَّٓائِلِ وَالْمَحْرُومِۖ ﴿٢٥﴾ وَالَّذ۪ينَ يُصَدِّقُونَ بِيَوْمِ الدّ۪ينِۖ ﴿٢٦﴾ وَالَّذ۪ينَ هُمْ مِنْ عَذَابِ رَبِّهِمْ
مُشْفِقُونَۚ ﴿٢٧﴾ اِنَّ عَذَابَ رَبِّهِمْ غَيْرُ مَأْمُونٍۚ ﴿٢٨﴾ وَالَّذ۪ينَ هُمْ لِفُرُوجِهِمْ حَافِظُونَۙ ﴿٢٩﴾ اِلَّا عَلٰٓى
اَزْوَاجِهِمْ اَوْ مَا مَلَكَتْ اَيْمَانُهُمْ فَاِنَّهُمْ غَيْرُ مَلُوم۪ينَۚ ﴿٣٠﴾ فَمَنِ ابْتَغٰى وَرَٓاءَ ذٰلِكَ فَاُو۬لٰٓئِكَ هُمُ الْعَادُونَ
ۚ﴿٣١﴾ وَالَّذ۪ينَ هُمْ لِاَمَانَاتِهِمْ وَعَهْدِهِمْ رَاعُونَۖ ﴿٣٢﴾ وَالَّذ۪ينَ هُمْ بِشَهَادَاتِهِمْ قَٓائِمُونَۖ ﴿٣٣﴾

---

**(*Qeyd:** *"Bu iki sifətin hər ikisi pis xüsusiyyətdir. Allah-Təala insanı azad yaradıb, şəri əmr edən xəbis nəfsin müqabilində ona şərəfli ağıl verib, insan nəfsinə qarşı cihad edərək, bu iki mənfi sifətin ziddini əldə etməyə qadirdir).*

**22-23) (** اِلَّا الْمُصَلّ۪ينَۙ اَلَّذ۪ينَ هُمْ عَلٰى صَلَاتِهِمْ دَٓائِمُونَ **) - İnsanın xüsusiyyəti belədir ki, qeyd olundu, ancaq istisnadır o şəxslər ki, namaz qılar, namazlarına davam edib, vaxtlı-vaxtında ədəb-ərkanla onu yerinə yetirərlər.**

**24-25) (** وَالَّذ۪ينَ ف۪ٓي اَمْوَالِهِمْ حَقٌّ مَعْلُومٌۙ لِلسَّٓائِلِ وَالْمَحْرُومِ **) - Və habelə o şəxslər ki, dilənçilərə və məhrum olduqları halda iffətlərindən ötrü dilənməyənlərə mallarından müəyyən payda haqlarını verərlər.**

**26) (** وَالَّذ۪ينَ يُصَدِّقُونَ بِيَوْمِ الدّ۪ينِ **) - Və habelə o şəxslər ki, cəza gününü** (qiyaməti) **təsdiq edirlər.**

**27) (** وَالَّذ۪ينَ هُمْ مِنْ عَذَابِ رَبِّهِمْ مُشْفِقُونَ **) - Və habelə o şəxslər ki, rəbləri Allah-Təalanın əzabından qorxub, çirkin əməlləri tərk edərlər.**

**28) (** اِنَّ عَذَابَ رَبِّهِمْ غَيْرُ مَأْمُونٍ **)** - (Ey Məhəmməd), **hərçənd şəxslər itaət və ibadətdə çox səy etsələr də, gərək, Allah-Təalanın əzabından xatircəm olmasınlar.**

**29) (** وَالَّذ۪ينَ هُمْ لِفُرُوجِهِمْ حَافِظُونَ **) - Və habelə o şəxslər ki, alətlərini zina etməkdən qoruyub saxlayırlar.**

**30) (** اِلَّا عَلٰٓى اَزْوَاجِهِمْ اَوْ مَا مَلَكَتْ اَيْمَانُهُمْ فَاِنَّهُمْ غَيْرُ مَلُوم۪ينَ **) Ancaq** (nikahlı) **xanımları ilə, ya da ki sahib olduqları kənizlərlə yaxınlıq edərlər.** (Həqiqətən, onlar bu əməllərinə görə qınanmazlar və məzəmmət edilməzlər).

**31) (** فَمَنِ ابْتَغٰى وَرَٓاءَ ذٰلِكَ فَاُو۬لٰٓئِكَ هُمُ الْعَادُونَ **) Kim bu iki yoldan başqa yollarla qadınlara yaxınlaşmaq istəsə, onlar Allah-Təalanın qoyduğu həddi aşıb, itaətdən çıxanlardır.**

**32) (** وَالَّذ۪ينَ هُمْ لِاَمَانَاتِهِمْ وَعَهْدِهِمْ رَاعُونَ **) - Və habelə o şəxslər ki, əmanət və əhdlərini qoruyub, riayət edərlər.**

**33) (** وَالَّذ۪ينَ هُمْ بِشَهَادَاتِهِمْ قَٓائِمُونَ **) - Və habelə o şəxslər ki, şəhadətlərini gizlətməyib, lazım olan məqamda dəyişdirməyib, həqiqəti üzrə necə ki, vaqe olub, yerinə yetirərlər.**

وَالَّذِينَ هُمْ عَلٰى صَلَاتِهِمْ يُحَافِظُونَ ﴿٣٤﴾ اُولٰٓئِكَ فِي جَنَّاتٍ مُكْرَمُونَ ﴿٣٥﴾ فَمَا لِ الَّذِينَ كَفَرُوا
قِبَلَكَ مُهْطِعِينَ ﴿٣٦﴾ عَنِ الْيَمِينِ وَعَنِ الشِّمَالِ عِزِينَ ﴿٣٧﴾ اَيَطْمَعُ كُلُّ امْرِئٍ مِنْهُمْ اَنْ يُدْخَلَ جَنَّةَ
نَعِيمٍ ﴿٣٨﴾ كَلَّاۜ اِنَّا خَلَقْنَاهُمْ مِمَّا يَعْلَمُونَ ﴿٣٩﴾ فَلَٓا اُقْسِمُ بِرَبِّ الْمَشَارِقِ وَالْمَغَارِبِ اِنَّا لَقَادِرُونَ
﴿٤٠﴾ عَلٰٓى اَنْ نُبَدِّلَ خَيْرًا مِنْهُمْ وَمَا نَحْنُ بِمَسْبُوقِينَ ﴿٤١﴾

---

**34) (وَالَّذِينَ هُمْ عَلٰى صَلَاتِهِمْ يُحَافِظُونَ) - Və habelə o şəxslər ki, namazlarının vaxtına və ədəb-ərkanına riayət edib, qoruyub, gözəl şəkildə yerinə yetirirlər.** (Namaz qılanların xüsusiyyətinin onu tərk etməyib, hər bir halda hökmən qıldıqları təkrar edildi).

**35) (اُولٰٓئِكَ فِي جَنَّاتٍ مُكْرَمُونَ) - Bu qeyd olunan sifətlərin sahibləri cənnətlərə daxil olub əziz, möhtərəm olacaqlar.** (Müşriklər dəstə-dəstə gəlib, peyğəmbərin ətrafına yığılıb, o cənabın kəlamına, Quran oxumasına qulaq asıb, ondan sonra istehza ilə deyirdilər: “Əgər bunlar cənnətə daxil olsalar, necə ki, Məhəmməd deyir, onlardan əvvəl biz daxil olarıq. O vaxt bu növbəti ayə nazil oldu).

**36) (فَمَا لِ الَّذِينَ كَفَرُوا قِبَلَكَ مُهْطِعِينَ) -** (Ey Məhəmməd), **nə olubdur bu kafirlərə ki, sürətlə sənin yanına gəlib, boyunlarını uzadıb sənə qulaq asırlar?**

**37) (عَنِ الْيَمِينِ وَعَنِ الشِّمَالِ عِزِينَ) Sağdan və soldan neçə dəstələrlə sənin ətrafına yığılıb, sənə istehza edirlər.**

**38) (اَيَطْمَعُ كُلُّ امْرِئٍ مِنْهُمْ اَنْ يُدْخَلَ جَنَّةَ نَعِيمٍ) - Bəlkə o müşriklərdən hər biri arzu edir ki, həmişəlik cənnətə daxil edilib, möminlər kimi nemət sahibi olsunlar?**

**39) (كَلَّا) Yox, heç vaxt onlar cənnətə daxil olmazlar, onlar yenidən dirilməyi inkar edirlər. (اِنَّا خَلَقْنَاهُمْ مِمَّا يَعْلَمُونَ) Həqiqətən, onlar özləri bilirlər ki, biz onları nədən yaratmışıq. Murdar, iy verən bir spermadan yaratmışıq. Daha əvvəl belə şeydən onları yaratmağa qadir olan yenidən yaratmağa qadir olmazmı? Bununla belə, ilk yaradılışlarına baxmayıb, yenidən yaradılmağı inkar edirlər.**

**40-41) (فَلَٓا اُقْسِمُ بِرَبِّ الْمَشَارِقِ وَالْمَغَارِبِ) Ey Məhəmməd, elə deyil ki, onlar yenidən dirilməyi inkar edirlər. Şərqlərin və Qərblərin rəbbi olan Allah-Təalaya** (öz müqəddəs zatıma) **and içrəm.**

**(اِنَّا لَقَادِرُونَ عَلٰٓى اَنْ نُبَدِّلَ خَيْرًا مِنْهُمْ وَمَا نَحْنُ بِمَسْبُوقِينَ) Həqiqətən, onları həlak edib, özlərindən daha yaxşı məxluqla əvəz etməyə biz qadirik və heç bir vaxt aciz deyilik.**

فَذَرْهُمْ يَخُوضُوا وَيَلْعَبُوا حَتّٰى يُلَاقُوا يَوْمَهُمُ الَّذِي يُوعَدُونَۙ ﴿٤٢﴾ يَوْمَ يَخْرُجُونَ مِنَ الْاَجْدَاثِ
سِرَاعًا كَاَنَّهُمْ اِلٰى نُصُبٍ يُوفِضُونَۙ ﴿٤٣﴾ خَاشِعَةً اَبْصَارُهُمْ تَرْهَقُهُمْ ذِلَّةٌۜ ذٰلِكَ الْيَوْمُ الَّذِي كَانُوا
يُوعَدُونَ﴿٤٤﴾

---

**42) (فَذَرْهُمْ يَخُوضُوا وَيَلْعَبُوا حَتّٰى يُلَاقُوا يَوْمَهُمُ الَّذِي يُوعَدُونَ)** - (Ey Məhəmməd), **müşriklərdən üz döndərib, burax onları, qoy onlara vəd edilən günü** (qiyaməti) **qarşılayıb, əzaba düçar olana qədər batil və boş sözlərə dalıb, dünyalarında oynasınlar. Daha onlara nəsihət də təsir edən deyildir.**

**43) (يَوْمَ يَخْرُجُونَ مِنَ الْاَجْدَاثِ سِرَاعًا كَاَنَّهُمْ اِلٰى نُصُبٍ يُوفِضُونَ)** - (Ey Məhəmməd), **o gün müşriklər yenidən dirilib, qəbirlərdən çıxıb, Allah-Təala tərəfindən dəvət edənə tərəf elə sürətlə gedərlər ki, sanki dünyada ibadət etdikləri bütlərin və daşların tərəfinə gedirlər.** (Müşriklərə istehza üçündür). **Yox, bütlərin tərəfinə getməyəcəklər. Əksinə onlardan intiqam alan mütləq qüdrət və əzəmət sahibi olan Allah-Təalanın tərəfinə gedib, əbədi əzaba düçar olacaqlar.**

**44) (خَاشِعَةً اَبْصَارُهُمْ تَرْهَقُهُمْ ذِلَّةٌ) Qorxudan gözlərini zəlilcəsinə aşağı dikib və özləri də zillət və həqarətə düşdükləri halda əzaba qəti inanarlar.**

**(ذٰلِكَ الْيَوْمُ الَّذِي كَانُوا يُوعَدُونَ) - Bu qeyd olunan gün həmin gündür ki, dünyada onlara vəd edilir. Lakin qəbul etmirlər. Lakin onlardan ötrü zahir olanda təkzib etmələrinə görə peşman olacaqlar.**

Allaha həmd olsun, əl-Məaric surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: *"Kim əl-Məaric surəsini oxusa, Allah-Təala ona əhd və əmanəti qoruyanların savabını bəxş edər."*

# NUH SURƏSİ

71-ci surədir. Məkkədə nazil olub, 28 ayə, 224 kəlmə və 999 hərfdir.

اِنَّٓا اَرْسَلْنَا نُوحًا اِلٰى قَوْمِهٖٓ اَنْ اَنْذِرْ قَوْمَكَ مِنْ قَبْلِ اَنْ يَاْتِيَهُمْ عَذَابٌ اَلِيمٌ ﴿١﴾ قَالَ يَا قَوْمِ اِنّ۪ي لَكُمْ
نَذ۪يرٌ مُب۪ينٌۙ ﴿٢﴾ اَنِ اعْبُدُوا اللّٰهَ وَاتَّقُوهُ وَاَط۪يعُونِۙ ﴿٣﴾ يَغْفِرْ لَكُمْ مِنْ ذُنُوبِكُمْ وَيُؤَخِّرْكُمْ اِلٰٓى اَجَلٍ
مُسَمًّىۜ اِنَّ اَجَلَ اللّٰهِ اِذَا جَٓاءَ لَا يُؤَخَّرُۢ لَوْ كُنْتُمْ تَعْلَمُونَ ﴿٤﴾ قَالَ رَبِّ اِنّ۪ي دَعَوْتُ قَوْم۪ي لَيْلًا وَنَهَارًاۙ
﴿٥﴾ فَلَمْ يَزِدْهُمْ دُعَٓاء۪ٓي اِلَّا فِرَارًا ﴿٦﴾

---

## Bismillahir-Rəhmanir-Rəhim

**1)** (اِنَّٓا اَرْسَلْنَا نُوحًا اِلٰى قَوْمِهٖٓ اَنْ اَنْذِرْ قَوْمَكَ مِنْ قَبْلِ اَنْ يَاْتِيَهُمْ عَذَابٌ اَلِيمٌ) - (Ey Məhəmməd), **həqiqətən, biz** (Nuhu) **öz qövmünə göndərib, ona əmr edib dedik: "Ey** (Nuh), **qövmünə əziyyət verən əzab** (tufan) **gəlməmiş onları bizim əzabımızla qorxudub, şirki tərk edib müvəhhid olmağa dəvət et.**

**2)** (قَالَ يَا قَوْمِ اِنّ۪ي لَكُمْ نَذ۪يرٌ مُب۪ينٌ) (Nuh) **bizim əmrimizə itaət edib, qövmünü dəvət etməyə başlayıb dedi: "Ey mənim qövmüm, həqiqətən, mən sizi Allah-Təalanın əzabı ilə qorxudan və Allah-Təalanın ehkamını bəyan edən peyğəmbərəm.**

**3-4)** (اَنِ اعْبُدُوا اللّٰهَ وَاتَّقُوهُ وَاَط۪يعُونِۙ) **Gərək Allah-Təalaya ibadət edib, müvəhhid olub və ondan qorxub asi olmayasınız. Ey qövm, sizə əmr və qadağa etdiyim şeylərdə mənə itaət edin.** (يَغْفِرْ لَكُمْ مِنْ ذُنُوبِكُمْ) **- Əgər mənə itaət edib yeganə Allah-Təalaya iman etsəniz, Allah-Təala sizin günahınızı bağışlayar.** (وَيُؤَخِّرْكُمْ اِلٰٓى اَجَلٍ مُسَمًّى) **Sizin üçün təyin edilən ölüm vaxtından əvvəl sizə əzab göndərməyib, həlak etməz. Əksinə, həmin müəyyən vaxta qədər təxirə salıb, o vaxt ölüm sizə gələr. Amma əgər itaət etməsəniz, əzab göndərib təyin edilmiş vaxtınızdan əvvəl sizi həlak edər.** (اِنَّ اَجَلَ اللّٰهِ اِذَا جَٓاءَ لَا يُؤَخَّرُۢ لَوْ كُنْتُمْ تَعْلَمُونَ) **Həqiqətən, Allah-Təalanın təyin etdiyi vaxt təxirə düşməyib, hər halda ölüm sizə gələcəkdir. Əgər siz agah olsanız ki, ölərkən nə qədər peşman olacaqsınız, əlbəttə iman edib, müvəhhid olarsınız.**

**5)** (قَالَ رَبِّ اِنّ۪ي دَعَوْتُ قَوْم۪ي لَيْلًا وَنَهَارًاۙ) **Elə ki** (Nuh ə.s.) **neçə illər qövmünü dəvət edib, onlar itaət etmədilər, axırda bezib, Allah-Təalanı çağırıb, onlara bəd dua edib belə dedi: "Ey mənim rəbbim, həqiqətən, mən qövmümü gecə və gündüz tövhidə və şirki tərk etməyə dəvət etdim."**

**6)** (فَلَمْ يَزِدْهُمْ دُعَٓاء۪ٓي اِلَّا فِرَارًا) **- Mənim dəvət etməyim onlara heç bir təsir etməyib, ancaq haqdan uzaqlaşmalarını daha da artırdı.**

وَاِنّ۪ي كُلَّمَا دَعَوْتُهُمْ لِتَغْفِرَ لَهُمْ جَعَلُٓوا اَصَابِعَهُمْ ف۪ٓي اٰذَانِهِمْ وَاسْتَغْشَوْا ثِيَابَهُمْ وَاَصَرُّوا وَاسْتَكْبَرُوا
اسْتِكْبَارًاۚ﴿٧﴾ ثُمَّ اِنّ۪ي دَعَوْتُهُمْ جِهَارًاۙ﴿٨﴾ ثُمَّ اِنّ۪ٓي اَعْلَنْتُ لَهُمْ وَاَسْرَرْتُ لَهُمْ اِسْرَارًاۙ﴿٩﴾
فَقُلْتُ اسْتَغْفِرُوا رَبَّكُمْ اِنَّهُ كَانَ غَفَّارًاۙ ﴿١٠﴾ يُرْسِلِ السَّمَٓاءَ عَلَيْكُمْ مِدْرَارًاۙ﴿١١﴾ وَيُمْدِدْكُمْ
بِاَمْوَالٍ وَبَن۪ينَ وَيَجْعَلْ لَكُمْ جَنَّاتٍ وَيَجْعَلْ لَكُمْ اَنْهَارًاۜ﴿١٢﴾ مَا لَكُمْ لَا تَرْجُونَ لِلّٰهِ وَقَارًاۚ﴿١٣﴾

---

**7) (وَاِنّ۪ي كُلَّمَا دَعَوْتُهُمْ لِتَغْفِرَ لَهُمْ جَعَلُٓوا اَصَابِعَهُمْ ف۪ٓي اٰذَانِهِمْ وَاسْتَغْشَوْا ثِيَابَهُمْ) Ey mənim rəbbim, həqiqətən, nə zaman ki, mən onları bağışlaman üçün tövbə etməyə dəvət etdim, onlar barmaqlarını qulaqlarına qoyub, libaslarını başlarına bürüdülər ki, mənim sözümü eşitməsinlər. (وَاَصَرُّوا وَاسْتَكْبَرُوا اسْتِكْبَارًا) Küfr və şirklərində israr edib, təkəbbürlənib iman etmədilər.**

**8) (ثُمَّ اِنّ۪ي دَعَوْتُهُمْ جِهَارًاۙ) Ey mənim rəbbim, ondan sonra elə ki, küfrlərində israr etdilər, yenə mən onlarda heç bir şəkk-şübhə qalmaması üçün hər bir yerdə açıq-aşkar onları imana dəvət etdim.**

**9) (ثُمَّ اِنّ۪ٓي اَعْلَنْتُ لَهُمْ وَاَسْرَرْتُ لَهُمْ اِسْرَارًاۙ) Elə ki, iman etmədilər, həqiqətən, onları təkrar açıq-aşkar dəvət etdim və gizli şəkildə də imkanım olduqca tək-tək onları dəvət etdim. Hər bir şəkildə onları dəvət etdim.** (Cənab Nuh onları xeyri əmr, haramı qadağan edən bütün əmrlərə necə ki, lazımdır, dəvət etdi).

**10) (فَقُلْتُ اسْتَغْفِرُوا رَبَّكُمْ اِنَّهُ كَانَ غَفَّارًاۙ) Ey mənim rəbbim, onlara dedim: gəlin tövbə eyləyin, Allah-Təaladan bağışlanmanızı istəyin. Həqiqətən, Allah-Təala günahları çox bağışlayandır.**

**11) (يُرْسِلِ السَّمَٓاءَ عَلَيْكُمْ مِدْرَارًاۙ) - Bağışlanmanızı istəməniz səbəbi ilə Allah-Təala sizə bol-bol yağış göndərib, xeyir-bərəkət nazil edər. Şə`bi deyir: Ömər ibn Xəttab bir dəfə yağış duasından ötrü Mədinədən kənara çıxdı. Allahdan bağışlanmasını istəməkdən başqa bir şey etməyib geri qayıtdı. Etiraz edib dedilər: "Yağış duasından ötrü getmişdin, amma heç yağış duası etmədin. Onların cavabında bu ayəni oxudu.**

**Yəni bağışlanmağı istəmək** (necə ki, Allah-Təala buyurur) **yağışın yağmasına səbəbdir.**

**12) (وَيُمْدِدْكُمْ بِاَمْوَالٍ وَبَن۪ينَ)** (Nuh deyir:) **Yenə bağışlanmanızı istəməniz səbəbi ilə Allah-Təala sizə mal-dövlət və oğlanlarla qüvvət verib sizi varlı edər. (وَيَجْعَلْ لَكُمْ جَنَّاتٍ وَيَجْعَلْ لَكُمْ اَنْهَارًا) Sizdən ötrü bağlar yaradar və o bağlarda çaylar axıdar. Gəlin, Allah-Təalaya iman edin.**

**13) (مَا لَكُمْ لَا تَرْجُونَ لِلّٰهِ وَقَارًاۚ)** (Nuh deyir:) **Ey qövm, nə olubdur sizə ki, axirətdə Allah-Təalanın sizə ehtiram, böyüklük bəxş etməsinə ümid etmirsiniz? Müvəhhid olun ki, Allah-Təala da qiyamət günündə sizə əcr-savab verib, sizi möhtərəm etsin.**

وَقَدْ خَلَقَكُمْ اَطْوَارًا ﴿١٤﴾ اَلَمْ تَرَوْا كَيْفَ خَلَقَ اللّٰهُ سَبْعَ سَمٰوَاتٍ طِبَاقًاۙ﴿١٥﴾ وَجَعَلَ الْقَمَرَ فِيهِنَّ
نُورًا وَجَعَلَ الشَّمْسَ سِرَاجًا﴿١٦﴾ وَاللّٰهُ اَنْبَتَكُمْ مِنَ الْاَرْضِ نَبَاتًاۙ ﴿١٧﴾ ثُمَّ يُعِيدُكُمْ فِيهَا وَيُخْرِجُكُمْ
اِخْرَاجًا﴿١٨﴾ وَاللّٰهُ جَعَلَ لَكُمُ الْاَرْضَ بِسَاطًاۙ﴿١٩﴾ لِتَسْلُكُوا مِنْهَا سُبُلًا فِجَاجًاۘ ﴿٢٠﴾

---

**14) (وَقَدْ خَلَقَكُمْ اَطْوَارًا) Nədən ötrü Allah-Təalaya iman etmirsiniz? Halbuki Allah-Təala sizi müxtəlif hal və surətlərdə yaradıbdır.** (Əvvəlcə sperma, ondan sonra laxtalanmış qan, ondan sonra bir parça ət, ondan sonra sümük, ondan sonra gözəl insan surətinə sizi daxil edibdir). **Belə bir yaradıcıya iman edib, ibadət etmək layiq deyilmi?**

**15) (اَلَمْ تَرَوْا كَيْفَ خَلَقَ اللّٰهُ سَبْعَ سَمٰوَاتٍ طِبَاقًاۙ) - Özünüzün yaradılışınıza fikir verəndən sonra bəs baxıb düşünmürsünüz ki, Allah-Təala yeddi səmanı necə bir-birinin üstündə təbəqə-təbəqə yaradıbdır?** (Kitabda yeddi səmanın nə olmasına təkrar işarə edilibdir).

**16) (وَجَعَلَ الْقَمَرَ فِيهِنَّ نُورًا) Səmaların içində nur yaratdı. (Yeddi səmadan məqsədin hava təbəqələri olduğu, bundan əvvəl işarə olunduğu kimi bu ayədə də açıq-aşkar işarə edilir. Hava təbəqələrinin içində görülən ay yer əhalisi üçün nur sayılır, yoxsa qədim astronomların dediyi şəkildə yeddi səmadakı (planetlərdəki) ayın nur olması mümkün deyildir.**

**16) (وَجَعَلَ الشَّمْسَ سِرَاجًا) - Və sizdən ötrü Allah-Təala günəşi çıraq etdi ki, onun yardımı ilə hər bir işinizi tamamlaya biləsiz.**

**17) (وَاللّٰهُ اَنْبَتَكُمْ مِنَ الْاَرْضِ نَبَاتًا)** (Nuh deyir:) **ey qövm, Allah-Təala hər bir növ ot və ağacı yerdən göyərdən kimi sizi də bir növ yerdən çıxardıb göyərtdi.** (Hər bir şeyi torpaqdan yaratdığı kimi siz insanları da torpaqdan yaratdı).

**18) (ثُمَّ يُعِيدُكُمْ فِيهَا وَيُخْرِجُكُمْ اِخْرَاجًا) - Ondan sonra ölüm sizə gəlib, həmin torpağa qaytarıb, yenidən sizi qiyamət günündə dirildib, torpaqdan çıxaracaqdır.**

**19-20) (وَاللّٰهُ جَعَلَ لَكُمُ الْاَرْضَ بِسَاطًاۙ لِتَسْلُكُوا مِنْهَا سُبُلًا فِجَاجًاۘ) Allah-Təala yeri sizin üçün döşək kimi açıq, geniş etdi ki, o yerdə geniş yollar açıb, məqsədinizə çata biləsiniz. Ey qövm, belə qadir və əzəmətli vahid yaradıcıya iman edib, müvəhhid olub, bütlərə sitayiş və ibadət etməyi tərk edin.** (Nuh bir neçə əsr qövmünü dəvət etdi, lakin itaət etməyib küfr və şirklərinə davam etdilər. Axırda Nuh təngə gəlib, onlara bəddua etdi. Necə ki, bundan sonra növbəti ayələrdə xəbər verir).

قَالَ نُوحٌ رَبِّ اِنَّهُمْ عَصَوْنِي وَاتَّبَعُوا مَنْ لَمْ يَزِدْهُ مَالُهُ وَوَلَدُهُ اِلَّا خَسَارًاۚ ﴿٢١﴾ وَمَكَرُوا مَكْرًا
كُبَّارًاۚ ﴿٢٢﴾ وَقَالُوا لَا تَذَرُنَّ اٰلِهَتَكُمْ وَلَا تَذَرُنَّ وَدًّا وَلَا سُوَاعًاۙ وَلَا يَغُوثَ وَيَعُوقَ وَنَسْرًاۚ﴿٢٣﴾
وَقَدْ اَضَلُّوا كَث۪يرًاۚ وَلَا تَزِدِ الظَّالِم۪ينَ اِلَّا ضَلَالًا ﴿٢٤﴾

---

**21) (قَالَ نُوحٌ رَبِّ اِنَّهُمْ عَصَوْنِي وَاتَّبَعُوا مَنْ لَمْ يَزِدْهُ مَالُهُ وَوَلَدُهُ اِلَّا خَسَارًاۚ) Nuh dedi: "Ey mənim rəbbim, hərçənd mən qövmümü tövhidə tərəf dəvət etdim. Həqiqətən, onlar mənə itaət etməyib asi oldular. Qiyamət günündə var-dövlətləri və övladları onlardan ötrü zərərdən başqa bir şey artırmayan var-dövlət sahibi rəislərinə tabe olub, onların əmri ilə bütpərəstliyə möhkəm şəkildə davam etdilər.**

**22) (وَمَكَرُوا مَكْرًا كُبَّارًاۚ) - İlahi, onların rəisləri məndən ötrü hiylələr tərtib edib, insanları mənim əleyhimə qaldırıb, haqq dinə tabe olmalarına mane olmaları üçün çox böyük məkr və hiylələr qurdular.**

**23-24) (وَقَالُوا لَا تَذَرُنَّ اٰلِهَتَكُمْ وَلَا تَذَرُنَّ وَدًّا وَلَا سُوَاعًاۙ) Rəislər haqq dinə mane olmaq üçün insanlara xitab edib dedilər: "Məbudlarınızı tərk etməyin, xüsusən böyük bütlərinizi* Vəddi və Süvanı tərk etməyin, Nuha tabe olmayın.**

**(وَلَا يَغُوثَ وَيَعُوقَ وَنَسْرًاۚ) Habelə Yəğusu, Yəuqu və Nəsri - bu üç böyük bütü də tərk etməyin. Gərək bunların ibadətinə davam edib, Nuha tabe olmayasınız.**

**(*Qeyd:** *Bütlər və bütpərəstlik Nuh qövmündən ərəblərə keçib. Kəlb qəbiləsi Vəddi, Həmdan qəbiləsi Süvanı, Məzhic qəbiləsi Yəğusu, Murad qəbiləsi Yəuqu, Himyər qəbiləsi Nəsri özlərinə məbud seçib, sitayiş etdilər və ərəblər də övladlarını Əbdi-Vədd, Əbdi-Yəğus adlandırırdılar (Buxari, Təfsiru sure, 71). Vədd kişi surətində, Süva qadın surətində, Yəğus şir surətində, Yəuq at surətində, Nəsr kərkəs (yırtıcı quş) surətində idilər. Bunlardan başqa da ərəblərin müxtəlif adlarda bütləri var idi. Bunların hamısı uca peyğəmbərimizin zühuru ilə zəlil və məhv olub, tövhid nuru fəsad içində olan aləmi işıqlandırdı. Əgər peyğəmbərimizin şirk və bütpərəstliyi məhv etməkdən başqa bir işi olmasaydı da, sadəcə bu işi onun şanının və dərəcəsinin ucalığına kifayət edərdi, halbuki o cənabın fəziləti elə bir dərəcədədir ki, əgər dünyanın bütün alimləri bir yerə yığılıb, hədislərin əsasında onun fəzilətlərini saymaq istəsələr, yenə də tam saya bilməyib, özlərinin aciz olduqlarını etiraf etməyə məcbur olarlar. Təfəkkür etmək lazımdır).*

**(وَقَدْ اَضَلُّوا كَث۪يرًاۚ)** (Nuh deyir:) **ilahi, bu rəislər çox şəxsləri zəlalətə salıb və bütpərəstlikdən çıxmasına mane oldular. (وَلَا تَزِدِ الظَّالِم۪ينَ اِلَّا ضَلَالًا) - İlahi, bu zalımların da ancaq zəlalətlərini artır.**

مِمَّا خَطِيَٓاتِهِمْ اُغْرِقُوا فَاُدْخِلُوا نَارًا فَلَمْ يَجِدُوا لَهُمْ مِنْ دُونِ اللّٰهِ اَنْصَارًا ﴿٢٥﴾ وَقَالَ نُوحٌ رَبِّ لَا تَذَرْ عَلَى الْاَرْضِ مِنَ الْكَافِرِينَ دَيَّارًا ﴿٢٦﴾ اِنَّكَ اِنْ تَذَرْهُمْ يُضِلُّوا عِبَادَكَ وَلَا يَلِدُوٓا اِلَّا فَاجِرًا كَفَّارًا ﴿٢٧﴾ رَبِّ اغْفِرْ لِي وَلِوَالِدَيَّ وَلِمَنْ دَخَلَ بَيْتِيَ مُؤْمِنًا وَلِلْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ وَلَا تَزِدِ الظَّالِمِينَ اِلَّا تَبَارًا ﴿٢٨﴾

---

**25) (مِمَّا خَطِيَٓاتِهِمْ اُغْرِقُوا فَاُدْخِلُوا نَارًا فَلَمْ يَجِدُوا لَهُمْ مِنْ دُونِ اللّٰهِ اَنْصَارًا)** - (Ey Məhəmməd), **Nuh qövmü xəta və günahlarından ötrü** (onlardan biri də şirk idi) **dənizə qərq olub, ondan sonra da dərhal cəhənnəm oduna daxil oldular. Allah-Təaladan başqa sitayiş etdikləri bütlərindən özlərinə bir kömək edən tapmadılar.** (Bu kəlam Nuh qövmünün sonunu peyğəmbərə bəyan etməkdən ötrü Nuhun sözlərinin arasında verilib. Növbəti ayədə yenə Nuhun kəlamından bəhs olunur).

**26) (وَقَالَ نُوحٌ رَبِّ لَا تَذَرْ عَلَى الْاَرْضِ مِنَ الْكَافِرِينَ دَيَّارًا) Nuh Allah-Təalanı çağırıb, qövmünə bəddua edib, belə dedi: "Ey mənim rəbbim, bu kafirləri həlak edib, yer üzündə bunlardan bir nəfər də hərəkət edən qoyma.**

**27) (اِنَّكَ اِنْ تَذَرْهُمْ يُضِلُّوا عِبَادَكَ وَلَا يَلِدُوٓا اِلَّا فَاجِرًا كَفَّارًا) Ey mənim rəbbim, həqiqətən, əgər sən onları yer üzündə sağ qoysan, digər iman edən bəndələrinzi də zəlalətə salıb, mürtədliklərinə bais olarlar. Onlardan ancaq fasiq və müşriklər doğular.** (Həzrəti Nuh ə.s. uzun illər onların arasında yaşayıb dəvət etdiyi üçün qəti inanırdı ki, onlardan olan övladlar da kafir və müşrik olub imana daxil olmayacaqlar və bu səbəbdən onlara bəddua etdi. Allah-Təala cənab Nuhun duasını qəbul edib, onun qövmünə tufan göndərib, hamısını həlak etdi).

**28) (رَبِّ اغْفِرْ لِي وَلِوَالِدَيَّ وَلِمَنْ دَخَلَ بَيْتِيَ مُؤْمِنًا وَلِلْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ وَلَا تَزِدِ الظَّالِمِينَ اِلَّا تَبَارًا)** (Ondan sonra Nuh Allahdan bağışlanmasını istəyib dedi:) **Ey mənim rəbbim, məni, ata-anamı, mənim evimə iman etdikləri halda daxil olanları və bütün mömin kişi və qadınları bağışla, zalımların da ancaq əzabını artır.**

Allaha həmd olsun, Nuh surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: *"Kim Nuh surəsini oxusa, Nuhun dəvəti ilə iman edənlərin səviyyəsində hesab olunar"*.

## əl-CİN SURƏSİ

72-ci surədir. Məkkədə nazil olub, 28 ayə, 285 kəlmə və 870 hərfdir.

قُلْ اُوحِيَ اِلَيَّ اَنَّهُ اسْتَمَعَ نَفَرٌ مِنَ الْجِنِّ فَقَالُوٓا اِنَّا سَمِعْنَا قُرْاٰنًا عَجَبًاۙ ﴿١﴾ يَهْدٖٓي اِلَى الرُّشْدِ فَاٰمَنَّا بِهٖۜ
وَلَنْ نُشْرِكَ بِرَبِّنَٓا اَحَدًاۙ ﴿٢﴾ وَاَنَّهُ تَعَالٰى جَدُّ رَبِّنَا مَا اتَّخَذَ صَاحِبَةً وَلَا وَلَدًاۙ ﴿٣﴾ وَاَنَّهُ كَانَ يَقُولُ
سَفٖيهُنَا عَلَى اللّٰهِ شَطَطًاۙ ﴿٤﴾ وَاَنَّا ظَنَنَّٓا اَنْ لَنْ تَقُولَ الْاِنْسُ وَالْجِنُّ عَلَى اللّٰهِ كَذِبًاۙ ﴿٥﴾ وَاَنَّهُ كَانَ
رِجَالٌ مِنَ الْاِنْسِ يَعُوذُونَ بِرِجَالٍ مِنَ الْجِنِّ فَزَادُوهُمْ رَهَقًاۙ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (قُلْ اُوحِيَ اِلَيَّ اَنَّهُ اسْتَمَعَ نَفَرٌ مِنَ الْجِنِّ فَقَالُوٓا اِنَّا سَمِعْنَا قُرْاٰنًا عَجَبًاۙ)** - (Ey Məhəmməd), **xalqa de ki, Allah-Təaladan mənə vəhy olundu ki, həqiqətən, mən Quran oxuyanda xəbərim olmadığı halda cinlərdən bir neçə nəfər gəlib, mənə qulaq asıb, qayıdıb camaatlarına tərəf gedib, onlara deyiblər ki, həqiqətən, fəsahət və bəlağəti qərbə olan bir Quran eşitdik,** (Məhəmmədə) **nazil olubdur.** (Bu kitabın bu cildində Əhqaf surəsinin 30-cu ayəsinin qeydində cinlərin təhqiqi məsələsi bəyan olunubdur. Oraya baxılsın).

**2) (يَهْدٖٓي اِلَى الرُّشْدِ فَاٰمَنَّا بِهٖۜ وَلَنْ نُشْرِكَ بِرَبِّنَٓا اَحَدًاۙ)** (Bundan sonra qövmlərinə xitab edən cinlərin kəlamıdır). **O Quran haqqa hidayət edir, biz bir neçə nəfər həmin Qurana iman edib, daha bundan sonra əbədiyyən rəbbimiz Allah-Təalaya heç kimi şərik qoşmarıq.**

**3) (وَاَنَّهُ تَعَالٰى جَدُّ رَبِّنَا مَا اتَّخَذَ صَاحِبَةً وَلَا وَلَدًاۙ) - Və həqiqətən, bizim rəbbimiz Allah-Təalanın şanı və əzəməti bütün məxluqlardan ucadır. Özündən ötrü nə bir qadın və nə də bir övlad götürməyibdir. Çünki Allah-Təala hər bir nöqsan və ehtiyacdan uzaqdır.**

**4) (وَاَنَّهُ كَانَ يَقُولُ سَفٖيهُنَا عَلَى اللّٰهِ شَطَطًاۙ) - Və həqiqətən, bizim səfeh və cahillərimiz Allah-Təalaya yalan və iftira isnad edib, ona şərik və övlad aid edirlər.**

**5) (وَاَنَّا ظَنَنَّٓا اَنْ لَنْ تَقُولَ الْاِنْسُ وَالْجِنُّ عَلَى اللّٰهِ كَذِبًاۙ) - Və həqiqətən, bizim gümanımız bu idi ki, insanlardan və cinlərdən heç kim Allah-Təalaya yalan isnad etməyib, ona qadın və övlad isnad etməkdə haqlıdırlar. Lakin Quranı eşitməklə onların yalanı məlum oldu.**

**6) (وَاَنَّهُ كَانَ رِجَالٌ مِنَ الْاِنْسِ يَعُوذُونَ بِرِجَالٍ مِنَ الْجِنِّ فَزَادُوهُمْ رَهَقًاۙ) - Və həqiqətən, insanlardan bəzi kişilər bəzi kişi cinlərlərə pənah aparırdılar və bu səbəb-**

وَاَنَّهُمْ ظَنُّوا كَمَا ظَنَنْتُمْ اَنْ لَنْ يَبْعَثَ اللّٰهُ اَحَدًاۙ ﴿٧﴾ وَاَنَّا لَمَسْنَا السَّمَٓاءَ فَوَجَدْنَاهَا مُلِئَتْ حَرَسًا
شَدٖيدًا وَشُهُبًاۙ ﴿٨﴾ وَاَنَّا كُنَّا نَقْعُدُ مِنْهَا مَقَاعِدَ لِلسَّمْعِۜ فَمَنْ يَسْتَمِعِ الْاٰنَ يَجِدْ لَهُ شِهَابًا رَصَدًاۙ ﴿٩﴾
وَاَنَّا لَا نَدْرٖيٓ اَشَرٌّ اُرٖيدَ بِمَنْ فِي الْاَرْضِ اَمْ اَرَادَ بِهِمْ رَبُّهُمْ رَشَدًاۙ ﴿١٠﴾ وَاَنَّا مِنَّا الصَّالِحُونَ وَمِنَّا
دُونَ ذٰلِكَۜ كُنَّا طَرَٓائِقَ قِدَدًاۙ ﴿١١﴾

---

**dən cinlər özlərini böyük məqam sahibi hesab edib, küfr və şirkləri daha da artırdı.** (Bu ayə bizim Əhqaf surəsində qeyd etdiyimiz mətləbi qüvvətləndirir).

**7) (**وَاَنَّهُمْ ظَنُّوا كَمَا ظَنَنْتُمْ اَنْ لَنْ يَبْعَثَ اللّٰهُ اَحَدًاۙ**) - Və həqiqətən, necə ki, siz cin tayfası zənn etdiniz, insanlar da sizin kimi zənn etdilər ki, Allah-Təala heç bir nəfərə yenidən həyat verməyib qiyamətdə hazır etməyəcəkdir.** (Amma Quran bu sözləri təkzib edir).

**8) (**وَاَنَّا لَمَسْنَا السَّمَٓاءَ فَوَجَدْنَاهَا مُلِئَتْ حَرَسًا شَدٖيدًا وَشُهُبًاۙ**) - Və həqiqətən, biz cinlər müşrik olduğumuz halda ucalıq və əzəmət sahibi olmaq istəsək də, şirk içində ucalıq istəməyin qarşısında od kimi yandırıcı və hiddətli oxlar və şiddətli keşikçilər gördük. Bu səbəbdən şirkdən çəkinib qaçmaq lazımdır.**

**9) (**وَاَنَّا كُنَّا نَقْعُدُ مِنْهَا مَقَاعِدَ لِلسَّمْعِ**) - Və həqiqətən, biz şirkin uca mərtəbəsində xurafat sözləri eşitməyə dair məqamlarda əyləşib küfr, şirk sözlərini eşidirdik. (**فَمَنْ يَسْتَمِعِ الْاٰنَ يَجِدْ لَهُ شِهَابًا رَصَدًاۙ**) Amma indi bu peyğəmbər** (Məhəmməd) **gələndən sonra kim ki, küfr və şirk kəlmələrinə qulaq assa, Allah-Təaladan onu gözləyən** (ox kimi) **alovları görər.** (İslamın yayılması ilə yanıb həlak olarlar). **Təfsirçilər bu ayələrin təfsirində belə deyiblər: "Cinlər peyğəmbərdən əvvəl göylərə qalxıb, mələklərin bəzi sözlərinə qulaq asırdılar. Peyğəmbər gələndən sonra Allah-Təala onları göydən ulduzlarla qovdu. Gecələr səmada müşahidə olunan meteorların, axan ulduzların cinləri qovduğuna inanıblar. Bu barədə adlarını təfsirçi qoyan alimlərə məzəmmət yoxdur, çünki səmadakı varlıqlardan və onların təbiətindən və həm də ulduzların həqiqətindən və əzəmətindən bixəbər olduqlarına görə hər bir ulduzu bir parça oddan ibarət olan döyüşçü kimi bir şey zənn edib, göyə qalxan cinləri onunla qovurlar.**

**10) (**وَاَنَّا لَا نَدْرٖيٓ اَشَرٌّ اُرٖيدَ بِمَنْ فِي الْاَرْضِ اَمْ اَرَادَ بِهِمْ رَبُّهُمْ رَشَدًاۙ**) - Və həqiqətən, biz bilmirik, yer üzündə məxluqata əzab arzu edilib, Allah-Təala əzab göndərib bütün müşrikləri həlak edəcək, yoxsa rəbləri Allah-Təala onlara yardım edib, doğru yol və hidayət arzulayıb, onları imana daxil edəcəkdir?**

**11) (**وَاَنَّا مِنَّا الصَّالِحُونَ وَمِنَّا دُونَ ذٰلِكَۜ كُنَّا طَرَٓائِقَ قِدَدًاۙ**) - Və həqiqətən, bizim içimizdə salehlər və salehlərdən başqa asilər də olub, müxtəlif məzhəblərə sahib olmuşuq. Amma indi gərək Qurana tabe olub, bir məzhəb sahibi olaq.**

وَاَنَّا ظَنَنَّآ اَنْ لَنْ نُعْجِزَ اللّٰهَ فِي الْاَرْضِ وَلَنْ نُعْجِزَهُ هَرَبًاۙ ﴿١٢﴾ وَاَنَّا لَمَّا سَمِعْنَا الْهُدٰىٓ اٰمَنَّا بِهٖۜ
فَمَنْ يُؤْمِنْ بِرَبِّهٖ فَلَا يَخَافُ بَخْسًا وَلَا رَهَقًاۙ ﴿١٣﴾ وَاَنَّا مِنَّا الْمُسْلِمُونَ وَمِنَّا الْقَاسِطُونَۜ فَمَنْ اَسْلَمَ
فَاُو۬لٰٓئِكَ تَحَرَّوْا رَشَدًا﴿١٤﴾ وَاَمَّا الْقَاسِطُونَ فَكَانُوا لِجَهَنَّمَ حَطَبًاۙ ﴿١٥﴾ وَاَنْ لَوِ اسْتَقَامُوا عَلَى
الطَّرٖيقَةِ لَاَسْقَيْنَاهُمْ مَآءً غَدَقًاۙ﴿١٦﴾

---

**12) (وَاَنَّا ظَنَنَّآ اَنْ لَنْ نُعْجِزَ اللّٰهَ فِي الْاَرْضِ وَلَنْ نُعْجِزَهُ هَرَبًاۙ) - Və həqiqətən, biz inanmışıq ki, yerdə olsaq, ya da (məsələn), səmaya qaçsaq, Allah-Təalanı aciz edib, ondan qurtula bilmərik. Hər bir halda Allah-Təala bizə qadirdir.**

**13) (وَاَنَّا لَمَّا سَمِعْنَا الْهُدٰىٓ اٰمَنَّا بِهٖ) - Və həqiqətən, o zaman ki, biz Quranı eşidib onun ehkamına agah olduq, ona iman edib, təsdiq etdik,**

**(فَمَنْ يُؤْمِنْ بِرَبِّهٖ فَلَا يَخَافُ بَخْسًا وَلَا رَهَقًاۙ) - Və kim ki, rəbbi Allah-Təalaya iman etmiş olsa, elə şəxs insanların onun haqqını* yeməsindən, ona zülm etməsindən, cəza verməsindən qorxmaz, nə də özü başqalarına zülm etməz, onların haqqını yeməz. Allahın cəzasından qorxar.**

(***Qeyd:** *Bu ayə dəlildir ki, iman edib, islama daxil olan şəxsin vəzifəsidir ki, gərək xalqın malına və canına zülm etməkdən çəkinsin. Uca peyğəmbərimiz buyurubdur: "Müsəlman odur ki, insanlar onu özlərinə və mallarına əmin saysınlar"(Buxari İman, 4). Bu hədisə görə çıraqla da axtarsaq, dünyada müsəlman tapmarıq, adlarını müsəlman qoyanlar bir dinarı bir-birilərinə etibar etməyib, bir-birilərinə inanmırlar. Borc, ya da əmanət verəndə əhd və sənəd alsalar da, yenə inkarçıların qarşısında haqqlarını isbat etməyə aciz qalırlar. Bu mətləb hər bir müsəlmana aydındır. Zahirdə bir-birləri ilə qardaş kimi rəftar edib, amma batində ən yırtıcı heyvanlar kimi bir-birlərindən çəkinirlər. Belə müsəlman olarmı? Gərək əxlaqlarını düzəldib, Qurani-Şərifin nəsihətlərindən faydalanıb, əsl həqiqi islamı dərk etmək lazımdır, yoxsa belə xəbis sifətlərə sahib olanların özlərini müsəlman sayması xətadır).*

**14) (وَاَنَّا مِنَّا الْمُسْلِمُونَ وَمِنَّا الْقَاسِطُونَۜ فَمَنْ اَسْلَمَ فَاُو۬لٰٓئِكَ تَحَرَّوْا رَشَدًا) - Və həqiqətən, bizim içimizdə həm Allah-Təalaya itaət edənlər və həm də kafirlər və haqq yoldan kənar olanlar vardır. Kim ki, islama daxil olsa, hidayət və doğru yolu cidd-cəhdlə axtarıb, haqqa qovuşanlar ancaq onlardır.**

**15) (وَاَمَّا الْقَاسِطُونَ فَكَانُوا لِجَهَنَّمَ حَطَبًاۙ) Amma haqdan kənar olan müşrik və kafirlər cəhənnəmin odunu və yanacağı olacaqlar.**

**16) (وَاَنْ لَوِ اسْتَقَامُوا عَلَى الطَّرٖيقَةِ لَاَسْقَيْنَاهُمْ مَآءً غَدَقًاۙ) -** (Ey Məhəmməd), **əgər cinlər özləri dedikləri kimi - islamın gözəl yolunda sabit və bərqərar olsalar, əlbəttə onlara çoxlu su verib, o suların səbəbinə ruzi qapılarını onların üzünə açarıq.**

لِنَفْتِنَهُمْ فِيهِۜ وَمَنْ يُعْرِضْ عَنْ ذِكْرِ رَبِّهِ يَسْلُكْهُ عَذَابًا صَعَدًاۙ ﴿١٧﴾ وَاَنَّ الْمَسَاجِدَ لِلّٰهِ فَلَا تَدْعُوا مَعَ
اللّٰهِ اَحَدًاۙ ﴿١٨﴾ وَاَنَّهُ لَمَّا قَامَ عَبْدُ اللّٰهِ يَدْعُوهُ كَادُوا يَكُونُونَ عَلَيْهِ لِبَدًاؕ ﴿١٩﴾ قُلْ اِنَّمَٓا اَدْعُوا رَبّ۪ي
وَلَٓا اُشْرِكُ بِه۪ٓ اَحَدًا ﴿٢٠﴾ قُلْ اِنّ۪ي لَٓا اَمْلِكُ لَكُمْ ضَرًّا وَلَا رَشَدًا ﴿٢١﴾ قُلْ اِنّ۪ي لَنْ يُج۪يرَن۪ي مِنَ
اللّٰهِ اَحَدٌ وَلَنْ اَجِدَ مِنْ دُونِه۪ مُلْتَحَدًاۙ ﴿٢٢﴾

---

**17) (لِنَفْتِنَهُمْ فِيهِۜ وَمَنْ يُعْرِضْ عَنْ ذِكْرِ رَبِّهِ يَسْلُكْهُ عَذَابًا صَعَدًاۙ) - Onlara çoxlu ruzi verərik ki, onları imtahan edək, bəs bizim nemətlərimizə necə şükür edirlər? Və kim ki, öz rəbbi Allah-Təalanı zikr etməkdən üz döndərir, Allah-Təala onu elə bir əzaba daxil edər ki, o əzab ona qalib olar, ondan nicat tapmaq mümkün olmaz.**

**18) (وَاَنَّ الْمَسَاجِدَ لِلّٰهِ فَلَا تَدْعُوا مَعَ اللّٰهِ اَحَدًاۙ) - Və həqiqətən,** (cinlər deyir:) **bütün ibadətgahlar Allah-Təalaya məxsusdur. Hansı ibadətgaha daxil olsanız, sadəcə Allah-Təalaya ibadət edib, təkcə ona dua edib, heç kimə onunla birlikdə dua etməyib, ona şərik qoşmayın.**

**19) (وَاَنَّهُ لَمَّا قَامَ عَبْدُ اللّٰهِ يَدْعُوهُ كَادُوا يَكُونُونَ عَلَيْهِ لِبَدًاؕ) - O zaman ki, Allah-Təalanın qulu və bəndəsi** (Məhəmməd) **peyğəmbərliyə başlayıb, şirk və küfrü məhv edib yeganə Allah-Təalaya dua edib, ibadət etməyə başladı, o vaxt müşriklər onun əməlinə təəccüb edib, onun üstünə cumub, istədilər onu qətl etsinlər. Lakin Allah-Təala onu pis adamların şərindən mühafizə etdi.**

**20) (قُلْ اِنَّمَٓا اَدْعُوا رَبّ۪ي وَلَٓا اُشْرِكُ بِه۪ٓ اَحَدًا) Elə ki, müşriklər peyğəmbərin üstünə cumub, onu qətl etmək istədilər, Allahın Rəsulu onlara dedi: "Mən nə çirkin iş eləmişəm ki, siz ona təəccüb edirsiniz, ancaq mən təkcə rəbbim Allah-Təalaya ibadət edib, heç bir nəfəri ona şərik qoşmuram. Cinlərin öz qövmlərinə təbliğ etdiyi kəlam bitdi.**

**21) (قُلْ اِنّ۪ي لَٓا اَمْلِكُ لَكُمْ ضَرًّا وَلَا رَشَدًا) -** (Ey Məhəmməd), **insanlara de ki, həqiqətən, mən sizə nə bir xeyir, nə də bir zərər verməyə qadir deyiləm. Zərər verən və mənfəət verən Allah-Təaladır. Mənim təklifim sizə ancaq ehkamı təbliğ etməkdir.**

**22) (قُلْ اِنّ۪ي لَنْ يُج۪يرَن۪ي مِنَ اللّٰهِ اَحَدٌ وَلَنْ اَجِدَ مِنْ دُونِه۪ مُلْتَحَدًاۙ) -** (Ey Məhəmməd), **insanlara de ki, əgər mən Allah-Təalaya asi olsam, heç kim mənə pənah verib, Allah-Təalanın əzabından məni qoruya bilməz və əlbəttə, mən də Allah-Təaladan başqa özümə bir sığınacaq tapa bilmərəm.**

اِلَّا بَلَاغًا مِنَ اللّٰهِ وَرِسَالَاتِهٖ وَمَنْ يَعْصِ اللّٰهَ وَرَسُولَهُ فَاِنَّ لَهُ نَارَ جَهَنَّمَ خَالِدٖينَ فٖيهَٓا اَبَدًا ﴿٢٣﴾
حَتّٰٓى اِذَا رَاَوْا مَا يُوعَدُونَ فَسَيَعْلَمُونَ مَنْ اَضْعَفُ نَاصِرًا وَاَقَلُّ عَدَدًا﴿٢٤﴾ قُلْ اِنْ اَدْرٖٓي اَقَرٖيبٌ
مَا تُوعَدُونَ اَمْ يَجْعَلُ لَهُ رَبّٖٓي اَمَدًا ﴿٢٥﴾ عَالِمُ الْغَيْبِ فَلَا يُظْهِرُ عَلٰى غَيْبِهٖٓ اَحَدًا ﴿٢٦﴾ اِلَّا مَنِ
ارْتَضٰى مِنْ رَسُولٍ فَاِنَّهُ يَسْلُكُ مِنْ بَيْنِ يَدَيْهِ وَمِنْ خَلْفِهٖ رَصَدًا﴿٢٧﴾ لِيَعْلَمَ اَنْ قَدْ اَبْلَغُوا رِسَالَاتِ
رَبِّهِمْ وَاَحَاطَ بِمَا لَدَيْهِمْ وَاَحْصٰى كُلَّ شَيْءٍ عَدَدًا ﴿٢٨﴾

---

**23) (اِلَّا بَلَاغًا مِنَ اللّٰهِ وَرِسَالَاتِهٖ) - Mən Allah-Təaladan olanları və sizə göndərdiyi hökmləri təbliğ etməkdən başqa bir şeyə malik deyiləm.**

**(وَمَنْ يَعْصِ اللّٰهَ وَرَسُولَهُ فَاِنَّ لَهُ نَارَ جَهَنَّمَ خَالِدٖينَ فٖيهَٓا اَبَدًا) Kim ki, Allah-Təalaya və onun peyğəmbərinə asi olsa, həqiqətən, ondan ötrü cəhənnəm odu vardır və həmişəlik cəhənnəmdə qalacaqdır.**

**24) (حَتّٰٓى اِذَا رَاَوْا مَا يُوعَدُونَ فَسَيَعْلَمُونَ مَنْ اَضْعَفُ نَاصِرًا وَاَقَلُّ عَدَدًا)** - (Ey Məhəmməd), **müşriklər səni zəif və köməksiz görüb sənə qalib gəlmək istəyirlər. Onlara vəd edilən əzabı** (Bədir günündə) **görənə qədər bunu istəyəcəklər. O vaxt biləcəklər ki, köməkçisi zəif və sayca az olan kimdir, sənsən, yoxsa, onlardır.** (Müşriklər istehza ilə deyirdilər: “Bu əzab ki, Məhəmməd bizə vəd edir, nə vaxt olacaqdır? Bu barədə növbəti ayə nazil oldu).

**25-26) (قُلْ اِنْ اَدْرٖٓي اَقَرٖيبٌ مَا تُوعَدُونَ اَمْ يَجْعَلُ لَهُ رَبّٖٓي اَمَدًا)** - (Ey Məhəmməd), **müşriklərə de ki, hər bir halda sizə əzab ediləcəkdir və onun vaqe olmasına şəkk-şübhə yoxdur. Lakin mən bilirəm ki, sizə vəd edilən əzabın vaxtı yaxındır. Tezliklə vaqe olacaq, ya da ki, ondan ötrü Allah-Təala elə bir müəyyən vaxt təyin edibdir ki, bundan sonra o müəyyən vaxtda sizə əzab ediləcəkdir. (عَالِمُ الْغَيْبِ فَلَا يُظْهِرُ عَلٰى غَيْبِهٖٓ اَحَدًا)**

**27) (اِلَّا مَنِ ارْتَضٰى مِنْ رَسُولٍ) Qeybə agah olan ancaq Allah-Təaladır. Qeyb elmindən heç kimi xəbərdar etməz. Ancaq özünün seçdiyi şəxsləri* qeyb elminə agah edər. (فَاِنَّهُ يَسْلُكُ مِنْ بَيْنِ يَدَيْهِ وَمِنْ خَلْفِهٖ رَصَدًا) Həqiqətən, Allah-Təala peyğəmbərin ön və arxa tərəfində gözətçilər və mühafizlər qoyar ki, pislərin şərindən onu mühafizə etsinlər.**

**(*Qeyd:** *“Bu ayə peyğəmbərlərdən başqalarına - imamlara və övliyalara möcüzə və qeyb elmini isnad etmə iddiasını batil edir, qeyb elmini bilməyi ancaq peyğəmbərlərə məxsus edir, düşünmək lazımdır).*

**28) (لِيَعْلَمَ اَنْ قَدْ اَبْلَغُوا رِسَالَاتِ رَبِّهِمْ) Allah-Təala peyğəmbərlər göndərib, onları pislərin şərindən mühafizə edir ki, onlar rəbləri Allah-Təalanın ehkamını artıq-əskik olmadan insanlara təbliğ etsinlər və bunda heç bir qüsur etmədiklərini Allah-Təala hamıya aydın etsin.**

**(وَاَحَاطَ بِمَا لَدَيْهِمْ وَاَحْصٰى كُلَّ شَيْءٍ عَدَدًا) Allah-Təala peyğəmbərlərin yanında**

**olan şəriət və ehkamı ehtiva edib, onların mühafizi və gözətçisidir. Hər bir şeyi, o cümlədən peyğəmbərlərə verilən ehkamı da bir-bir sayıb qeyd edibdir.**

Allaha  həmd olsun, Cin surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: "Kim Cin surəsini oxusa, qulam azad etmiş kimi savab qazanar.

## əl-MUZZƏMMİL SURƏSİ

73-cü surədir. Məkkədə nazil olub, 20 ayə, 285 kəlmə və 838 hərfdir.

يَآ اَيُّهَا الْمُزَّمِّلُ ۙ ﴿١﴾ قُمِ الَّيْلَ اِلَّا قَلٖيلًا ۙ ﴿٢﴾ نِصْفَهُ اَوِ انْقُصْ مِنْهُ قَلٖيلًا ۙ ﴿٣﴾ اَوْ زِدْ عَلَيْهِ وَرَتِّلِ
الْقُرْاٰنَ تَرْتٖيلًا ۜ ﴿٤﴾

---

### Bismillahir-Rəhmanir-Rəhim

**1-4) (** يَآ اَيُّهَا الْمُزَّمِّلُ ۙ قُمِ الَّيْلَ اِلَّا قَلٖيلًا ۙ نِصْفَهُ اَوِ انْقُصْ مِنْهُ قَلٖيلًا ۙ اَوْ زِدْ عَلَيْهِ وَرَتِّلِ الْقُرْاٰنَ تَرْتٖيلًا ۜ **) Ey peyğəmbərliklə vəzifələndirilən (Ey Məhəmməd), gərək peyğəmbərlik üçün qalxıb, onu təbliğ etməkdə fövqəladə zəhmətləri yüklənəsən. Nəinki gündüz, hətta gecə də bir az yatıb, rahat olmaqla kifayət etməyib, gecənin yarısını, ya da ki, yarıdan da bir qədər az, ya da ki, çox (ayıq) keçirib, peyğəmbərlik üçün qalxıb, Quranın ehkamını dürüst şəkildə bəyan edib, müşriklərə bildir.**

**(*Qeyd:** *Təfsirçilər bu ayəyə gecə namazı qılmaq mənası veriblər. Mövlana Cəlaləddin Rumi surənin təfsirinə işarə edib deyir:*

*- "Peyğəmbərə bu səbəbdən deyildi: "Ey örtüsünə bürünən, ey hürküb qaçan, örtüdən çıx! Örtünü başına çəkmə, üzünü örtmə, (çünki aləm çaşqın bir bədən, sənsə bu aləmin ağlısan! Özünə gəl, savaşmaq istəyənlərdən utanıb gizlənmə, çünki səndə vəhy şamının nurları var! Özünə gəl, gecələri qalx, çünki ey peyğəmbər şam gecələri ayaqda durar! Sənin nurun olmadıqca, aydın bir gün də gecədir, sənə sığınmadıqca, aslan da dovşana dönər! Ya Mustafa! (ə.s) Bu nur dənizində kapitanlıq et, çünki sən ikinci Nuhsan! Ağıllılara yol göstərən lazımdır, hələ yol dəniz yolu isə. Sən zamanın Xızırısan, hər gəminin imdadına çatan sənsən. Ruhullah kimi tək gəzməyi özünə adət etmə! Bu cəmiyyətin önündə göydəki işıq kimisən, günəşə bənzəyirsən, bunlardan gizlənmə, xəlvəti süsləməyə çalışma! Xəlvət zamanı deyil, cəmiyyətə gəl! Ey peyğəmbər (ə.s), hidayət Qaf dağına bənzər, sənsə Huma (səadət) quşusan! Ay göydə gecələr gəzər, itlərin səsi səbəbi ilə gəzməkdən imtina etməz. Qınayanlar sənin ayına qarşı çıxan itlərə oxşayırlar, qoy sənə qarşı hürməyə davam etsinlər. Bu itlər "susun, qulaq asın" əmrinə qarşı kardırlar, axmaqlıqlarından sənin ayına qarşı hürürlər. Ey şəfa, xəstəni tərk etmə, kara qızıb, korun əsasını buraxma! Sən demədinmi ki, "Koru yoldan keçirən Allahdan yüzlərlə əcr-savab alar. Kim bir koru qırx addım gəzdirərsə, günahları bağışlanar, doğru yolu tapar". Elə isə bu qərarsız cahandakı korları dəstə-dəstə gəzdir! Doğru yolu göstərənin işi budur, sən də doğru yolu göstərənsən, qiyamətin yasının nəşəsisən sən! Ey təqva sahiblərinin imamı, bu xəyallara qoşulanları haqq*

**إِنَّا سَنُلْقِي عَلَيْكَ قَوْلًا ثَقِيلًا ﴿٥﴾ إِنَّ نَاشِئَةَ اللَّيْلِ هِيَ أَشَدُّ وَطْئًا وَأَقْوَمُ قِيلًا ﴿٦﴾ إِنَّ لَكَ فِي النَّهَارِ سَبْحًا طَوِيلًا ﴿٧﴾ وَاذْكُرِ اسْمَ رَبِّكَ وَتَبَتَّلْ إِلَيْهِ تَبْتِيلًا ﴿٨﴾ رَبُّ الْمَشْرِقِ وَالْمَغْرِبِ لَا إِلَٰهَ إِلَّا هُوَ فَاتَّخِذْهُ وَكِيلًا ﴿٩﴾ وَاصْبِرْ عَلَىٰ مَا يَقُولُونَ وَاهْجُرْهُمْ هَجْرًا جَمِيلًا ﴿١٠﴾**

---

*məqamına qədər apar! Kimin qəlbindən sənə qarşı bir hiylə keçərsə, onun boynunu mən vuraram, sən məhzun olma, nəşələn, nəşəli-nəşəli gəz!"*

*(Bu fəzilətli şəxsin kəlamına baxanda bütün gün və gecə ifadəsinin simvolik olaraq işləndiyi anlaşılıb, peyğəmbərin düşmənlərindən qorxmayıb, təbliğə həvəsləndirmək məqsədini ifadə etdiyi görülür. Əlbəttə alim və arif şəxslərə bu mətləb məxfi deyildir. Amma gecələr namaz qılıb ibadət etmək o cənabın özünün vəzifəsi olub, peyğəmbərlik vəzifəsinin müqabilində təşəkkür etməkdən ötrü o cənaba layiqdir ki, gücü çatdığı qədər ibadətə davam edib, qüsur etməsin).*

**5) (إِنَّا سَنُلْقِي عَلَيْكَ قَوْلًا ثَقِيلًا)** - (Ey Məhəmməd), **həqiqətən, biz əmri və qadağaları ehtiva edən ağır bir kəlamı** (Quranı) **sənə göndərdik. Gərək onun təbliği üçün qalxıb, bizim əmr və qadağalarımızı insanlara çatdırasan.**

**6) (إِنَّ نَاشِئَةَ اللَّيْلِ هِيَ أَشَدُّ وَطْئًا وَأَقْوَمُ قِيلًا)** - (Ey Məhəmməd), **gecələr dünya işlərindən sıyrılmaq səbəbi ilə həqiqətən, gecə vaxtı qalxmaq çox gözəl əmrdir. Gecələr insanın arzusu Haqq ilə bir və qəlbinin tərcümanı olan dili qəlbindən olan əmrlərlə uyğun olub, dediyi söz möhkəm və eşidənlərin qəlblərinə təsir edici olar.** (Qüreyş camaatı gecələr Məscidül-Haramda (Hatim adlana yerdə) yığılıb, məclis təşkil etdiklərinə görə Allahın Rəsulu da gecə vaxtı digər işlərdən sıyrılması səbəbi ilə gecələr onları dəvət etməklə vəzifələndirildi. Yəni Allah-Təalanın dəvətçisi üçün gərək gecə-gündüz dəvət etmək çətin olmasın. Dəvətində yandıran od kimi olub, heç bir məzəmmət edənin məzəmmətinə gərək baxmasın).

**7) (إِنَّ لَكَ فِي النَّهَارِ سَبْحًا طَوِيلًا وَاذْكُرِ اسْمَ رَبِّكَ وَتَبَتَّلْ إِلَيْهِ تَبْتِيلًا)** - (Ey Məhəmməd), **tövhid və təqdislə rəbbin Allah-Təalanın adını zikr edib, insanları tövhidə dəvət etməkdə hər bir işini, insanları buraxıb, Allah-Təalaya etimad et.**

**9) (رَبُّ الْمَشْرِقِ وَالْمَغْرِبِ لَا إِلَٰهَ إِلَّا هُوَ فَاتَّخِذْهُ وَكِيلًا) Şərqdə və Qərbdə olan məxluqun tərbiyə verən rəbbi Allah-Təaladır. Ondan başqa haqq məbud yoxdur.** (Ey Məhəmməd), **onu özünə vəkil seçib, hər bir işini ona həvalə et.**

**10) (وَاصْبِرْ عَلَىٰ مَا يَقُولُونَ وَاهْجُرْهُمْ هَجْرًا جَمِيلًا)** - (Ey Məhəmməd), **müşriklərin acı, dadısz-duzsuz sözlərinə səbir edib, gözəl şəkildə onları tərk edib, kənar ol.** (Müşriklərin istəklərinə tabe olmayıb, qəlbində onları tərk et. Lakin zahirdə onlarla gözəl əxlaqla rəftar edib, onları qınamayıb, əziyyətlərinə qarşılıq verme).

وَذَرْنِي وَالْمُكَذِّبِينَ اُولِي النَّعْمَةِ وَمَهِّلْهُمْ قَلِيلًا ﴿١١﴾ اِنَّ لَدَيْنَآ اَنْكَالًا وَجَحِيمًاۙ ﴿١٢﴾ وَطَعَامًا
ذَا غُصَّةٍ وَعَذَابًا اَلِيمًا ﴿١٣﴾ يَوْمَ تَرْجُفُ الْاَرْضُ وَالْجِبَالُ وَكَانَتِ الْجِبَالُ كَثِيبًا مَهِيلًا ﴿١٤﴾ اِنَّآ
اَرْسَلْنَآ اِلَيْكُمْ رَسُولًا شَاهِدًا عَلَيْكُمْ كَمَآ اَرْسَلْنَآ اِلٰى فِرْعَوْنَ رَسُولًاؕ ﴿١٥﴾ فَعَصٰى فِرْعَوْنُ الرَّسُولَ
فَاَخَذْنَاهُ اَخْذًا وَبِيلًا ﴿١٦﴾ فَكَيْفَ تَتَّقُونَ اِنْ كَفَرْتُمْ يَوْمًا يَجْعَلُ الْوِلْدَانَ شِيبًاۗ ﴿١٧﴾ اَلسَّمَآءُ مُنْفَطِرٌ
بِهٖؕ كَانَ وَعْدُهُ مَفْعُولًا ﴿١٨﴾ اِنَّ هٰذِهٖ تَذْكِرَةٌۚ فَمَنْ شَآءَ اتَّخَذَ اِلٰى رَبِّهٖ سَبِيلًا ﴿١٩﴾

---

**11)** (وَذَرْنِي وَالْمُكَذِّبِينَ اُولِي النَّعْمَةِ وَمَهِّلْهُمْ قَلِيلًا) - (Ey Məhəmməd), **səni təkzib edən nemət sahiblərini** (Qüreyş rəislərini) **tərk edib, onların işlərini mənə həvalə edib, az bir zamana** (Bədir gününə) **kimi onlara möhlət ver. Mən özüm onlara cəza verəcəm.**

**12)** (اِنَّ لَدَيْنَآ اَنْكَالًا وَجَحِيمًاۙ) **- Dünya əzabının yanında, axirətdə də müşriklərdən ötrü bizim yanımızda böyük və ağır zəncirlər var ki, onlarla bağlanıb hərəkət etməyə qadir olmazlar və cəhənnəm əzabı vardır.**

**13)** (وَطَعَامًا ذَا غُصَّةٍ وَعَذَابًا اَلِيمًا) **- Və boğazlarında tıxanıb qalan yemək və əziyyət verən əzab vardır.**

**14)** (يَوْمَ تَرْجُفُ الْاَرْضُ وَالْجِبَالُ وَكَانَتِ الْجِبَالُ كَثِيبًا مَهِيلًا) **Bu əzablar müşriklərdən ötrü hazırdır. O gündə ki, yer və dağlar sarsılıb, zəlzələnin şiddətindən dağlar dağılıb, sel kimi axan qum kimi olar.**

**15)** (اِنَّآ اَرْسَلْنَآ اِلَيْكُمْ رَسُولًا شَاهِدًا عَلَيْكُمْ كَمَآ اَرْسَلْنَآ اِلٰى فِرْعَوْنَ رَسُولًاؕ) **Ey müşriklər, həqiqətən, biz sizə** (Məhəmmədi) **peyğəmbər göndərdik. Sizin küfr və şirkinizə və hər bir əməllərinizə bizim yanımızda şəhadət edəcəkdir. Necə ki, sizdən əvvəl** (Musanı) **firona peyğəmbər göndərdik.**

**16)** (فَعَصٰى فِرْعَوْنُ الرَّسُولَ فَاَخَذْنَاهُ اَخْذًا وَبِيلًا) **Firon da sizin kimi peyğəmbərə** (Musaya) **asi oldu. O zaman da biz onu şiddətli bir əzabla yaxalayıb** (suya qərq etdik).

**17)** (فَكَيْفَ تَتَّقُونَ اِنْ كَفَرْتُمْ يَوْمًا يَجْعَلُ الْوِلْدَانَ شِيبًاۗ) **- Əgər siz insanlar kafir olub, Allah-Təalaya şərik qoşsanız, dəhşətli şiddəti və əzabı uşaqları qocaldan bir günün** (qiyamətin) **əzabından necə özünüzü mühafizə edib, nəyə pənah aparacaqsınız? Ogünkü gündə Allah-Təaladan başqa heç bir şeyə ümid etmək olmaz.**

**18)** (اَلسَّمَآءُ مُنْفَطِرٌ بِهٖؕ كَانَ وَعْدُهُ مَفْعُولًا) **Səma o əzəmət və möhkəmliyinə baxmayaraq parçalanar.** (Fəzada olan bütün kürələr məhv olacaq. Səmanın halı belə olanda, digər məxluqların halı necə olacaqdır?) **Allah-Təalanın qiyamət günü haqqında verdiyi vədi sabit və bərqərardır. Əlbəttə, vaqe olacaqdır.**

**19)** (اِنَّ هٰذِهٖ تَذْكِرَةٌۚ فَمَنْ شَآءَ اتَّخَذَ اِلٰى رَبِّهٖ سَبِيلًا) - (Ey Məhəmməd), **bu əzabı**

اِنَّ رَبَّكَ يَعْلَمُ اَنَّكَ تَقُومُ اَدْنٰى مِنْ ثُلُثَيِ الَّيْلِ وَنِصْفَهُ وَثُلُثَهُ وَطَٓائِفَةٌ مِنَ الَّذٖينَ مَعَكَۜ وَاللّٰهُ يُقَدِّرُ الَّيْلَ وَالنَّهَارَۜ عَلِمَ اَنْ لَنْ تُحْصُوهُ فَتَابَ عَلَيْكُمْ فَاقْرَؤُ۫ا مَا تَيَسَّرَ مِنَ الْقُرْاٰنِۜ عَلِمَ اَنْ سَيَكُونُ مِنْكُمْ مَرْضٰىۙ وَاٰخَرُونَ يَضْرِبُونَ فِي الْاَرْضِ يَبْتَغُونَ مِنْ فَضْلِ اللّٰهِۙ وَاٰخَرُونَ يُقَاتِلُونَ فٖي سَبٖيلِ اللّٰهِۘ فَاقْرَؤُ۫ا مَا تَيَسَّرَ مِنْهُۙ وَاَقٖيمُوا الصَّلٰوةَ وَاٰتُوا الزَّكٰوةَ وَاَقْرِضُوا اللّٰهَ قَرْضًا حَسَنًاۜ وَمَا تُقَدِّمُوا لِاَنْفُسِكُمْ مِنْ خَيْرٍ تَجِدُوهُ عِنْدَ اللّٰهِ هُوَ خَيْرًا وَاَعْظَمَ اَجْرًاۜ

---

**bildirən ayələr nəsihət qəbul edən şəxslərdən ötrü bir vəzdir. Hər bir şəxs istəsə öz ixtiyarı ilə nəsihəti qəbul edib, təqva edərək, öz rəbbi Allah-Təalanın tərəfinə bir yol tapar, hansı ki o yol onu haqqa qovuşdurar.**

**20)** (اِنَّ رَبَّكَ يَعْلَمُ اَنَّكَ تَقُومُ اَدْنٰى مِنْ ثُلُثَيِ الَّيْلِ وَنِصْفَهُ وَثُلُثَهُ وَطَٓائِفَةٌ مِنَ الَّذٖينَ مَعَكَ) - (Ey Məhəmməd), **həqiqətən, sənin rəbbin Allah-Təala agahdır ki, bəzən təqribən gecənin üçdə ikisini, bəzən gecənin yarısını, bəzən də gecənin üçdə birini sən və möminlərdən bir qrupu səninlə birlikdə ibadətlə və peyğəmbərliyi təbliğlə keçirirsiniz.**

(وَاللّٰهُ يُقَدِّرُ الَّيْلَ وَالنَّهَارَۜ عَلِمَ اَنْ لَنْ تُحْصُوهُ فَتَابَ عَلَيْكُمْ) **Gecə və gündüzü öz kamil qüdrəti ilə təqdir edən Allah-Təaladır. Sizin gecənin saat və dəqiqələrini sayıb, onun yarısını və üçdə birini oyaq keçirməyə qadir olmadığınıza Allah-Təala agahdır və yenə gecələr sizdən ötrü müəyyən bir vaxt təyin etməkdən imtina edib, sizin özünüzə imkan verdi ki, sizə necə mümkündürsə, elə hərəkət edib, insanları dəvət edəsiniz.** (فَاقْرَؤُ۫ا مَا تَيَسَّرَ مِنَ الْقُرْاٰنِ) **Nə qədər mümkündürsə, o qədər Qurani-Şərifdən əzbərləyib, onun ehkamını digər şəxslərə bildirin.** (Bu mətləb bütün müsəlmanlara şamildir).

(عَلِمَ اَنْ سَيَكُونُ مِنْكُمْ مَرْضٰىۙ) **Allah-Təala agahdır ki, sizlərdən bəziniz xəstə olur.** (وَاٰخَرُونَ يَضْرِبُونَ فِي الْاَرْضِ يَبْتَغُونَ مِنْ فَضْلِ اللّٰهِ) **- Və başqa elə şəxslər olur ki, Allah-Təalanın rəhmətindən ruzi istəməkdən ötrü yer üzündə səfər edir.** (وَاٰخَرُونَ يُقَاتِلُونَ فٖي سَبٖيلِ اللّٰهِ) **- Və elə şəxslər də olur ki, Allah-Təalanın yolunda cihadla məşğul olurlar. Belə işlərlə məşğul olan halda möminlərə islama dəvət etmək işi daha çox təklif olunmaz.** (فَاقْرَؤُ۫ا مَا تَيَسَّرَ مِنْهُ) **Ancaq sizə bu işlərlə məşğul olsanız da mümkün olan qədər Qurani-Şərifdən əzbərləyib, ehkamını digər şəxslərə bildirmək lazımdır.**

(وَاَقٖيمُوا الصَّلٰوةَ وَاٰتُوا الزَّكٰوةَ وَاَقْرِضُوا اللّٰهَ قَرْضًا حَسَنًا) **Namaz qılıb, zəkat verib, hər bir xeyir əmələ yönəlib, Allah-Təalaya gözəl şəkildə borc verin** (sədəqə verin) **ki, sizdən ötrü** (savab və malınızı) **artırsın.**

(وَمَا تُقَدِّمُوا لِاَنْفُسِكُمْ مِنْ خَيْرٍ تَجِدُوهُ عِنْدَ اللّٰهِ هُوَ خَيْرًا وَاَعْظَمَ اَجْرًاۜ) **- Özünüz üçün öncədən nə xeyir əməl göndərsəniz, onu Allah-Təalanın yanında taparsınız, o əvvəlcə göndərdiyiniz sizdən ötrü dünyada qoyduğunuzdan yaxşıdır və savabı da daha böyükdür.**

وَاسْتَغْفِرُوا اللّٰهَ ۖ إِنَّ اللّٰهَ غَفُورٌ رَحِيمٌ ﴿٢٠﴾

---

**(وَاسْتَغْفِرُوا اللّٰهَ ۖ إِنَّ اللّٰهَ غَفُورٌ رَحِيمٌ) Etdiyiniz yaxşılıqlardakı qüsurlarınız və günahlarınız üçün Allah-Təaladan bağışlanmanızı istəyin. Həqiqətən, Allah-Təala əfv edilmək istəyib, tövbə edənləri bağışlayandır.**

Allaha həmd olsun, əl-Muzzəmmil surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: "Kim əl-Muzzəmmil surəsini oxusa, Allah-Təala da dünyada və axirətdə çətinliyi ondan dəf edər."

## əl-MUDDƏSSİR SURƏSİ

74-cü surədir. Məkkədə nazil olub, 55 ayə, 255 kəlmə və 1010 hərfdir.

**Bismillahir-Rəhmanir-Rəhim**

Uca peyğəmbərimiz peyğəmbərliklə vəzifələndirilmədən əvvəl ildə bir dəfə təxminən bir ay Məkkəyə yaxın olan Hira dağında guşənişin olub, ibadətə çəkilib, öz bildiyi kimi Allah-Təalaya ibadət edərdi. Peyğəmbər olduğu il Hira dağında olan mağarada rəcəb ayının 27-ci gecəsində ibadətdən sonra əbasına bürünüb yatmışdı. Əbanın altından mağaranın nurlanması o cənaba məlum oldu. İstədi, başını açsın, qorxu o cənabı bürüyüb, başını açmadı. Mağaradakı nur artıb, o cənabın qulağına da bəzi xoş səslər gəlirdi. Məcbur qalıb, başını qaldırıb mağaranı (elm və irfan nuru ilə) nurlanmış gördü. O zaman Ruhülmüqəddəs, şəriət dili ilə Cəbrayıl izzətli Allah-Təala tərəfindən o cənabın qəlbində maarif və hikmət qapılarını açıb, mübarək Ələq surəsini o alicənaba göndərib, o da hikmət və maariflə dolu olan qəlbi ilə o surəni əzbərlədi. Bu surə peyğəmbərə nazil olan Qurani-Şərifin ilk surəsidir. Elə ki surə nazil olub, elm və maarif qapısı o cənabın üzünə açıldı, hərçənd surədə insanları dəvət etməklə vəzifələndirilməsə də, (hansı ki, neçə illər Hira dağında guşənişin olub, ibadət etməkdə əsl məqsədi insanları şirkdən tövhidə dəvət etmək üçün bir yol tapmaq idi), lakin surənin nazil olmasındakı əsl uca məqsədin tövhidi təbliğ etməklə məsul olduğu mənasını anlayaraq sübh açılandan sonra mağaradan çıxıb, Məkkə tərəfinə yola düşdü, o uca cənaba elə bir qəribə hal üz vermişdi ki, hər bir hərəkətindən məlum olurdu. O halda gedib mənzilinə daxil olub, xanımı Xədicə onun bu qəribə halını müşahidə edəndə nə olduğunu soruşdu. O cənab da əhvalatı olduğu kimi nəql etdi. Xədicə dedi: "Heç fikir etmə, sən yaxşı əməl sahibi, qohum-əqrəbayla əlaqəsini kəsməyən, əmin bir şəxssən. Bu iş peyğəmbərliyinin başlanğıcıdır, yəqin ki, insanları dəvət etməklə vəzifələndiriləcəksən. Gedək, səni aparım əmim oğlu Varaqa ibn Novfəlin yanına, həmin Varaqa Xədicənin əmisi oğlu idi, xristian dininə daxil olub, səmavi kitabları oxumuşdu. Ömrünün axır vaxtı olub, gözləri də kor olmuşdu. Xədicə peyğəmbəri götürüb, Varaqanın yanına gedib, əhvalatı nəql etdi. Varaqa peyğəmbərin əlindən yapışıb dedi: "Sənə gələn baş mələk Cəbrayıldır, İsa ibn Məryəmin müjdələdiyi də sənsən və peyğəmbərliklə məsul olmusan, istəyərdim ki, ömrüm çataydı və peyğəmbərlik işində sənə kömək edib, dini yaymaqda yardımçın olaydım. Peyğəmbər oradan qayıdıb evdə əyləşib, bu işin sonunu düşünürdü. Neçə gün vəhy gəlmədi, peyğəmbər qorxu və ümid arasında evdə guşənişin olub, bu məsələni düşünürdü ki, o

يَآ اَيُّهَا الْمُدَّثِّرُ ۙ﴿١﴾ قُمْ فَاَنْذِرْ ۙ﴿٢﴾ وَرَبَّكَ فَكَبِّرْ ۙ﴿٣﴾ وَثِيَابَكَ فَطَهِّرْ ۙ﴿٤﴾ وَالرُّجْزَ فَاهْجُرْ ۙ﴿٥﴾
وَلَا تَمْنُنْ تَسْتَكْثِرُ ۙ﴿٦﴾

---

xoşbəxt anda o məclisdə Muddəssir surəsi nazil olub, onu açıq-aşkar dəvət etməklə vəzifələndirdi. O cənab ümid etdiyi şeyə qovuşub, Allaha təvəkkül edib, mərd-mərdanə, fövqəladə bir həvəs və sevinclə evindən çıxıb, gedib Səfa təpəsinə çıxdı. Camaatı çağırıb, kiçik-böyük, bütün Məkkə əhli də oraya yığıldı. O cənab Haqq-Təala tərəfindən vəzifələndirildiyini onlara elan edib, onları tövhidə və şirki tərk etməyə dəvət etdi. Məkkə əhli, xüsusən rəisləri və o cənabın qohum-əqrəbaları, əmiləri bu mətləbə üzülüb, ondan üz döndərdilər. Bundan sonra surənin təfsiri başlayır.

**1-2) (يَآ اَيُّهَا الْمُدَّثِّرُ قُمْ فَاَنْذِرْ) Ey əyninə** (xalat) **əba geyib, evdə əyləşən!** (Ey Məhəmməd), **ayağa durub əzm ilə insanları tövhidə dəvət edib, küfr və şirkin günahını onlara bildirib, iman etməyənləri bizim əzabımızla qorxut.**

**3) (وَرَبَّكَ فَكَبِّرْ)** - (Ey Məhəmməd), **rəbbin Allah-Təalanı uca tutub, qüdrət və əzəməti ilə onu vəsf et.** (Elə ki, bu ayə nazil oldu, peyğəmbər "Allahu-əkbər" dedi. Xədicə də ona tabe olub, Allahu-əkbər deyib, onun peyğəmbərliyinə qəti inanıb, şad oldu).

**4) (وَثِيَابَكَ فَطَهِّرْ) Libasını pislikdən təmizlə.** (Nəfsini xəbis və rəzil sifətlərdən pak və uca edib, gözəl əxlaqla süslə. Adətən belə deyilir: filankəsin "ətəyi təmizdir", yəni namusludur, nəfsi xəbis və çirkin sifətlərdən pakdır, ayə bu mənadadır. Qurani-Şərifin xitabı adət-ənənə üzrədir. Əksər təfsirçilərin dediyi kimi bu ayəyə namazda libasın pak olması mənasını vermək onun əvvəlinə və sonuna münasib olmamaqla birlikdə, ayənin dərin və uca mənasını tərk edib, zahiri mənasına yönəlmək sayılar. Bu məqamda belə mənanın uyğun olmaması ağıl sahiblərinin nəzərində günün ortasındakı günəş kimi aydındır. Diqqət etmək lazımdır).

**5) (وَالرُّجْزَ فَاهْجُرْ ۙ) - **(Ey Məhəmməd), **hər bir əzaba bais olan işləri** (bütpərəstlik və digər günahları) **necə ki, tərk edibsən, onda sabit və bərqərar olub, insanlara da tərk etməyi əmr et.**

**6) (وَلَا تَمْنُنْ تَسْتَكْثِرُ ۙ) Sahibi olduğun maldan ümmətin kasıblarına da verib, onların ehtiyaclarını dəf etmək üçün sərf et. Lakin elə olmasın ki, mal sərf etməkdə* məqsədin minnət qoymaq, riyakarlıq olsun. Çünki sən** (Ey Məhəmməd), **gözəl əxlaqla və üstün tərbiyə ilə məsulsan. Belə iş sənə layiq deyildir.**

**(*Qeyd:** *"Bu əmrlər təkcə peyğəmbərə aid olmayıb, hətta bütün islam ümməti*

﴿وَلِرَبِّكَ فَاصْبِرْ ﴿٧﴾ فَإِذَا نُقِرَ فِي النَّاقُورِ ﴿٨﴾ فَذَٰلِكَ يَوْمَئِذٍ يَوْمٌ عَسِيرٌ ﴿٩﴾ عَلَى الْكَافِرِينَ غَيْرُ يَسِيرٍ ﴿١٠﴾

---

*bu əmrlərlə məsuldurlar. Qurani-Şərifin xitabları hərçənd cənab peyğəmbərədir, lakin o cənab o xitabları digər məxluqata bildirməklə məsul olub, Quran əhli də onlara əməl etməyə məsuldurlar və bu səbəbdən o cənab möcüzəli bəyanıyla buyurdu: "Gözəl əxlaqınızı və üstün tərbiyənizi tamamlamaqdan ötrü göndərilmişəm. O pak cənabda hansı gözəl sifətlər varsa, onları biz müsəlmanlara bildirib və o sifətlərə sahib olmamızı bizə əmr edibdir. Bu mübarək surənin əvvəlindən ta bu ayəyə kimi diqqətlə baxıb, bu məsələləri təfəkkür etmək lazımdır ki, Allah-Təala necə öz peyğəmbərinə ilk dəfədən bəşəriyyətin dünya və axirətdəki mənfəət və zərərlərini necə göstərib, əmr edibdir, xüsusən axırıncı ayədə ümmətin ehtiyaclarını dəf etmək üçün dünya malını sərf edib, minnət qoymamağı əmr edibdir. Heyf ki, müsəlmanlarda görən göz, eşidən qulaq və dərk edən qəlb olmayıb, Qurani-Şərifə əməl etməyib, ancaq mübarək Ramazan ayında, ya da ki, ölüləri cənnətə göndərmək üçün onu oxuyub, qissə və hekayə kitabı kimi zənn ediblər. Ey peyğəmbər, Qurani-Şərif haqqında etdiyin o vəsiyyət ki, - ümmətim ona sarılıb, bilənlər bilməyənlərə öyrətsin - tərk edilib, rəy sahibləri ortaya çıxıb, Qurani-Şərifin xilafına rəylər verib, bidətlər yaradıb, avam xalqı çaşqın və sərgərdan qoyublar. Ey peyğəmbər, adlarını məzhəb və millət rəisi qoyanlar təqva ilə yaradılan dinin əsasını bərbad etdilər. İslamın adından başqa bir şey qalmayıbdır. Qurani-Şərifin ehkamı hökmsüz qalıb, uydurma və Qurana zidd hədislər şəriət sayılıbdır. Guya peyğəmbər (ə.s) qəbrindən bizlərə səslənib deyir: "Bu əmrlər hamısı dürüst və səhihdir. Bunların hamısının səbəbi cəhalət adlanan öldürücü bir xəstəlikdir. O xəstəliyin atəşini elmin saf və sərin suyu ilə söndürməsəniz, nicat tapmayacaqsınız. Hərçənd deyəcəksiniz ki, bizdə elm və alimlər vardır, hansı ki, elmlərini Qurana və hədislərə isnad edirlər. Lakin o elmlər Qurana zidd və nəfsani arzulara xidmət etdiyindən elm olmayıb, onlara cəhalət səbəbi demək daha doğrudur. Elmdən insaf, mürüvvət, qardaşlıq, bərabərlik, vətənpərvərlik, var-dövləti millətin ehtiyacları yolunda xərcləmə, bağışlama, çalışma kimi əməllər meydana gələr, sizdə isə bunların əksi müşahidə olunur, bəs niyə özünüzə alim deyib, iftira edirsiniz? Niyə Quranın ehkamına sarılıb, Qurana zidd əməlləri tərk etmirsiniz? Sizin halınız dünyada bundan da betərdir. Axirətə isə Allah-Təala agahdır).*

**7) (وَلِرَبِّكَ فَاصْبِرْ)** - (Ey Məhəmməd), **Allah-Təaladan ötrü hər bir işdə** (xüsusən islama dəvət etməkdə) **səbrə sarılıb, səbri özünə şüar et.**

**8-9-10) (فَإِذَا نُقِرَ فِي النَّاقُورِ فَذَٰلِكَ يَوْمَئِذٍ يَوْمٌ عَسِيرٌ عَلَى الْكَافِرِينَ غَيْرُ يَسِيرٍ)** - (Ey Məhəmməd), **müşriklərin əziyyətlərinə səbir edib onlardan ötrü bəyan et ki, onların qarşılarında çətin bir gün vardır ki, o gündə əməllərinin cəzası onlara yetişəcəkdir. O zaman ki, vurulan şeyə vuruldu, ogünkü gündə kafirlər üçün çətin bir gün olub, möminlərə asan olduğu kimi kafirlərə**

**asan olmayacaqdır.** (O gün Bədir günündən ibarətdir, hansı ki, kafirlər üçün çətin bir gün oldu. Savaş zamanı deyilər ki, məsələn, savaş təbili vuruldu, eyni şəkildə ayədəki bu ifadə də adət-ənənə üzrədir. Yəni o zaman ki, bizim tərəfimizdən kafirlərdən ötrü öldürülmək və əsir olmaq hökmü verildi, Bədir günü onlardan ötrü cəza təbili vuruldu. O gün onlar üçün çətin bir gün olacaqdır. Allah-Təala vəhyin elə ilk ayələrindən iman etməyən müşriklərə dünyada əzab vədi verir ki, küfr və şirkdən imana tərəf qayıtsınlar. Təfsirçilərin əksəriyyəti ayəyə axirət əzabı mənası verib, "naqur"dan məqsəd buynuzdan olan İsrafil surudur, deyibdirlər. Amma buynuz hansı heyvanın buynuzudur, təyin etməyiblər. Afərin belə təfsirçilərə, Qurani-Şərifə belə boş mənalar vermək layiqdirmi? İslamın bu gününə oturub ağlamaq lazımdır. Vəlid ibn Müğirə Taif əhlindən olub, Məkkədə Qüreyş camaatının arasında var-dövlət sahibi mötəbər bir şəxs idi. Elə ki, Hz. Məhəmməd peyğəmbərliyə başlayıb, Məkkə əhlini dəvət etməyə başladı, Qüreyş camaatının rəisləri toplanıb, peyğəmbərin haqqında məşvərət etdilər. Vəlid ibn Müğirə dedi: "Mən gedib sizdən ötrü xəbər gətirərəm. Gedib peyğəmbəri Məscidül-haramda namaz qılarkən gördü. Peyğəmbər namazda Fussilət surəsini oxuyurdu, Vəlid peyğəmbərə yaxın durub, ona diqqətlə qulaq asdı. Oradan qayıdıb Qüreyşin məclisinə getdi. Dedi: vallah, indi Məhəmməddən elə bir kəlam eşitmişəm ki, nə insan, nə də cin kəlamı deyildir. Vallah, onda bəlağət və məlahət vardır. O kəlam həmişə uca olub, heç bir şey ondan uca olmayacaqdır. Vəlid bu sözü deyib, öz evinə getdi. Qüreyş camaatı bu sözdən məhzun olub, dedilər: Vəlid dindən çıxdı, vallah, bütün Qüreyş camaatı dindən çıxacaq. Əbu Cəhl dedi: "Qəmgin olmayın, mən Vəlidi islama daxil olmağa qoymaram. Vəlidin evinə gedib, qəmgin şəkildə əyləşdi. Vəlid Əbu Cəhlə dedi: "Qardaş oğlu, nə olub? Səni qəmgin görürəm. Əbu Cəhl dedi: "Necə qəmgin olmayım, Qüreyş camaatı sənin haqqında deyirlər ki, bu mal-dövlətlə Məhəmmədin və Əbu Bəkrin yanına gedirsən ki, onların yeməyinin artığından yeyəsən, əgər var-dövləti azdırsa, bir qədər də ona mal verək. Daha gedib Məhəmmədin və Əbu Bəkrin yeməyinə bənd olmasın. Vəlid dedi: "Qüreyş mənim haqqımda belə sözlər deyir? Məhəmməd və onun səhabələri nə vaxt yeyib doyublar ki, yeməklərinin artığı da qalsın? Vəlid hirslənib, ayağa durub Qüreyşin məclisinə (Darün-Nədvəyə) getdi. Ayaq üstündə durub dedi: "Ey insanlar, Məhəmmədə dəlilik isnad edirsiniz, amma onda dəlilik görübsünüzmü? Məhəmmədə falçı deyirsiniz, amma onu falçılıq edən görübsünüzmü? Məhəmmədə şair deyirsiniz, amma onu şeir oxuyan və ya şeir deyən görübsünüzmü? Məhəmmədə yalançı deyirsiniz, amma onun yalan dediyini görübsünüzmü? Qüreyş camaatı bu sözlərin cavabında dedilər: "Allah-Təala şahiddir ki, bu əməllərin heç birini onda görməmişik. Ondan sonra Vəlidə dedilər: "Bəs Məhəmməd kimdir və onun haqqında nə demək doğrudur? Bir qədər fikirləşib, başını aşağı salıb, o tərəfə, bu tərəfə gedib axırda dedi: "Ona sehrbazdan başqa bir şey demək ol-

ذَرْنٖي وَمَنْ خَلَقْتُ وَحٖيدًاۙ ﴿١١﴾ وَجَعَلْتُ لَهُ مَالًا مَمْدُودًاۙ ﴿١٢﴾ وَبَنٖينَ شُهُودًاۙ ﴿١٣﴾ وَمَهَّدْتُ لَهُ
تَمْهٖيدًاۙ ﴿١٤﴾ ثُمَّ يَطْمَعُ اَنْ اَزٖيدَۗ ﴿١٥﴾ كَلَّاۜ اِنَّهُ كَانَ لِاٰيَاتِنَا عَنٖيدًاۜ ﴿١٦﴾ سَاُرْهِقُهُ صَعُودًاۜ ﴿١٧﴾

---

maz. Ən doğrusu sehrbaz deməkdir. Çünki Məhəmməd də sehrbazlar kimi ata ilə oğul, ya da ailə içində təfriqə salır, bu səbəbdən ona sehrbaz demək olur. Bu sehrləri Yəməndəki Müseylimədən və Babildəki sehrbazlardan öyrənibdir.

Bu sözdən məclis əhli şad olub, dağıldılar. Bu səbəbdən Vəlid barəsində növbəti ayələr nazil oldu).

**11) (** ذَرْنٖي وَمَنْ خَلَقْتُ وَحٖيدًاۙ **) - (Ey Məhəmməd), o şəxsi ki, (Vəlid və onun kimilər) mən özüm təkcə yaradıb, onun yaradılmasında heç kim mənə şərik olmayıbdır, onun işini mənə həvalə edib, məni onunla öz halımızda burax. Gör ondan necə intiqam alacam.**

**12-13) (**وَجَعَلْتُ لَهُ مَالًا مَمْدُودًاۙ وَبَنٖينَ شُهُودًاۙ**) - Onu yaratmaqdan başqa, ona çoxlu var-dövlət və hal-hazırda gördüyünüz kimi, Məkkədə kişilər cərgəsinə qoşulan* oğlanlar da verdim.**

(***Qeyd:** Vəlidin on oğlu var idi. Hamısı öz həyatında yetkinlik məqamına çatdı. Onlardan üçü islama daxil oldu. Onlardan birincisi məşhur şücaətli qəhrəman, islamın əsas himayədarlarından biri olan Xalid, ikinci Ümarə, üçüncüsü Hişamdır, qalanları ataları Vəlidlə birlikdə küfr içində həlak oldular).

**14) (**وَمَهَّدْتُ لَهُ تَمْهٖيدًاۙ**) - Və ona cah-cəlal və hakimiyyət verib, hər bir nemətini bol etdim.** (Vəlid Qüreyşin arasında ən varlı şəxs olduğuna görə Qüreyş tərəfindən ona “reyhanətü-Qüreyş” – “Qüreyşin ən bol ruzi sahibi” ləqəbi verilmişdi).

**15) (**ثُمَّ يَطْمَعُ اَنْ اَزٖيدَ**) Nemətlərini bol edəndən sonra tamah etdi ki, o nemətlərini daha da artırım.**

**16) (**كَلَّاۜ**) Heç vaxt artırmaram, əksinə o nemətləri də zay olacaqdır.**

**(**اِنَّهُ كَانَ لِاٰيَاتِنَا عَنٖيدًاۜ**) Həqiqətən,** (Vəlid), **bizim tövhid və qüdrətimizə işarə edən ayələrə qarşı inadkar və inkarçı oldu. Belə şəxs nemətinin artırılmasına layiq deyildir.**

(Bu ayə nazil olandan sonra Vəlidin malı yavaş-yavaş azaldı, özü həlak olana kimi malı da tamamilə yox oldu).

**17) (**سَاُرْهِقُهُ صَعُودًاۜ**)** (Vəlidi) **əlbəttə əbədiyyən rahatlığı olmayan bir əzaba düçar edərəm.**

اِنَّهُ فَكَّرَ وَقَدَّرَۙ ﴿١٨﴾ فَقُتِلَ كَيْفَ قَدَّرَۙ ﴿١٩﴾ ثُمَّ قُتِلَ كَيْفَ قَدَّرَۙ ﴿٢٠﴾ ثُمَّ نَظَرَۙ ﴿٢١﴾ ثُمَّ
عَبَسَ وَبَسَرَۙ ﴿٢٢﴾ ثُمَّ اَدْبَرَ وَاسْتَكْبَرَۙ ﴿٢٣﴾ فَقَالَ اِنْ هٰذَٓا اِلَّا سِحْرٌ يُؤْثَرُۙ ﴿٢٤﴾ اِنْ هٰذَٓا اِلَّا قَوْلُ
الْبَشَرِؕ ﴿٢٥﴾ سَاُصْلِيهِ سَقَرَ ﴿٢٦﴾وَمَٓا اَدْرٰيكَ مَا سَقَرُؕ ﴿٢٧﴾ لَا تُبْقِي وَلَا تَذَرُۚ ﴿٢٨﴾ لَوَّاحَةٌ
لِلْبَشَرِۚ﴿٢٩﴾ عَلَيْهَا تِسْعَةَ عَشَرَؕ ﴿٣٠﴾ وَمَا جَعَلْنَٓا اَصْحَابَ النَّارِ اِلَّا مَلٰٓئِكَةًۙ وَمَا جَعَلْنَا عِدَّتَهُمْ اِلَّا
فِتْنَةً لِلَّذِينَ كَفَرُواۙ لِيَسْتَيْقِنَ الَّذِينَ اُوتُوا الْكِتَابَ وَيَزْدَادَ الَّذِينَ اٰمَنُٓوا إيمَانًا

---

**18) (اِنَّهُ فَكَّرَ وَقَدَّرَۙ) Həqiqətən,** (Vəlid) **Quran haqqında təfəkkür edib, öz nəfsində ondan ötrü dediyi sözü təqdir etdi.**

**19) (فَقُتِلَ كَيْفَ قَدَّرَ) - Əzab ona şamil olub, rəhmətimizdən kənar olsun, necə də Quran haqqında ona münasib olmayan sözə qərar verdi.**

**20) (ثُمَّ قُتِلَ كَيْفَ قَدَّرَۙ) Yenə əzab ona şamil olub, rəhmətimizdən kənar olsun, necə də Quran haqqında ona münasib olmayan sözə qərar verdi.**

**21) (ثُمَّ نَظَرَۙ) - Ondan sonra Quran haqqında camaata söz deməkdən ötrü onların üzünə baxdı.**

**22) (ثُمَّ عَبَسَ وَبَسَرَۙ) - Ondan sonra üz-gözünü qırışdırıb, qaşqabağını tökdü.**

**23) ( ثُمَّ اَدْبَرَ وَاسْتَكْبَرَۙ ) - Ondan sonra haqqı qəbul etməkdən birdəfəlik üz döndərdi.**

**24) (فَقَالَ اِنْ هٰذَٓا اِلَّا سِحْرٌ يُؤْثَرُۙ) Axırda qərar verdiyi sözü dedi: "Bu Quran sehrdən başqa bir şey deyil.** (Məhəmməd) **onu sehrbazlardan öyrənib.**

**25) (اِنْ هٰذَٓا اِلَّا قَوْلُ الْبَشَرِؕ) Sehr olmaqla birlikdə, Allah-Təalanın kəlamı deyil, əksinə insan kəlamıdır. Ona Allah-Təalanın kəlamı demək xətadır.**

**26) (سَاُصْلِيهِ سَقَرَ)** (Ey Məhəmməd) **- Əlbəttə** (Vəlid və onun kimilərini) **Səqərə daxil edərəm.** (Cəhənnəmin bir adı da Səqərdir).

**27) (وَمَٓا اَدْرٰيكَ مَا سَقَرُؕ) -** (Ey Məhəmməd), **Səqərin nə olduğu və orada necə şiddətli əzab olması haqqında sənə heç bir şey bildirməyib və bizdən başqa da sənə bildirən olmaz.**

**28) (لَا تُبْقِي وَلَا تَذَرُۚ) Səqərin xüsusiyyəti budur ki, asilərdən bir nəfər də qoymayıb, hamısının bədənlərini yandırıb, daim əzabda olarlar.**

**29) (لَوَّاحَةٌ لِلْبَشَرِۚ) - Onun odu insanın cildini dəyişdirib, yandırıb şiddətlə qaraldandır.**

**30) (عَلَيْهَا تِسْعَةَ عَشَرَؕ) - Cəhənnəmdə on doqquz rəis (mələk) vardır.**

**31) (وَمَا جَعَلْنَٓا اَصْحَابَ النَّارِ اِلَّا مَلٰٓئِكَةً) - Cəhənnəm rəislərini ancaq mələklərdən seçdik ki, insanlarla münasibəti olmayıb, əzab etməkdə rəhm etməsinlər.**

**(وَمَا جَعَلْنَا عِدَّتَهُمْ اِلَّا فِتْنَةً لِلَّذِينَ كَفَرُواۙ لِيَسْتَيْقِنَ الَّذِينَ اُوتُوا الْكِتَابَ وَيَزْدَادَ الَّذِينَ اٰمَنُٓوا إيمَانًا) - Cəhənnəm rəislərinin sayını ancaq kafir və müşrikləri imtahan* etmək,**

وَيَهْدِي مَنْ يَشَآءُ وَلَا يَرْتَابَ الَّذِينَ اُوتُوا الْكِتَابَ وَالْمُؤْمِنُونَ ۙ وَلِيَقُولَ الَّذِينَ فِي قُلُوبِهِمْ مَرَضٌ وَالْكَافِرُونَ مَاذَآ اَرَادَ اللّٰهُ بِهٰذَا مَثَلًا ۜ كَذٰلِكَ يُضِلُّ اللّٰهُ مَنْ يَشَآءُ وَيَهْدِي مَنْ يَشَآءُ ۜ وَمَا يَعْلَمُ جُنُودَ رَبِّكَ اِلَّا هُوَ ۜ وَمَا هِيَ اِلَّا ذِكْرٰى لِلْبَشَرِ ﴿٣١﴾ كَلَّا وَالْقَمَرِ ۙ ﴿٣٢﴾ وَالَّيْلِ اِذْ اَدْبَرَ ۙ ﴿٣٣﴾

---

**kitab əhlinin** (yəhudi və xristianların) **iman etməsi və möminlərin də imanını daha da artırması üçün** (on doqquz) **etdik ki, görək Allah-Təalanın hikmətli əməllərini qəbul edirlər, yoxsa yox? Mələklərin sayının on doqquz olması Allah-Təaladan olan bir haqqdır.**

(***Qeyd:** *Elə ki, bu ayə nazil oldu, Əbu Cəhl Qüreyş camaatına dedi: "Ananız matəminizdə əyləşsin, eşidirəm Əbu Kəbşənin oğlu sizə xəbər verir ki, cəhənnəmin rəisləri on doqquz nəfərdir, siz hamınız şücaətli, igid şəxslərsiniz, bəs sizin bir nəfəriniz onlardan on nəfərə qarşı durmağa aciz olarmı? Əbül-Əşəd ibn Üseyd ibn Kəldə şücaətli bir şəxs idi. Dedi: "İkisi sizin, on yeddisinə mən kifayət edərəm. Məkkədə Əbu Kəbşə adlı bir kişi bütpərəstlikdən üz döndərib, Şir`a ulduzuna sitayiş edirdi. Peyğəmbərin dini onun dini kimi Qüreyş dinindən fərqli olduğuna görə istehza edib peyğəmbərə Əbu Kəbşənin oğlu deyirdilər).*

(وَيَهْدِي مَنْ يَشَآءُ وَلَا يَرْتَابَ الَّذِينَ اُوتُوا الْكِتَابَ وَالْمُؤْمِنُونَ) **Kitab əhli və möminlər cəhənnəm rəislərinin sayının on doqquz olmasına heç vaxt şübhə etməzlər.**

(وَلِيَقُولَ الَّذِينَ فِي قُلُوبِهِمْ مَرَضٌ وَالْكَافِرُونَ مَاذَآ اَرَادَ اللّٰهُ بِهٰذَا مَثَلًا ۜ) **Amma qəlblərində şəkk-şübhə olanlar və kafirlər əlbəttə deyirlər: "Allah-Təala bu təəccüblü on doqquz ədədi ilə nə arzu edib və niyyəti nədir ki, mələklərin sayını on doqquz edib, iyirmi etməyib? Bu kəlam Allah-Təaladan deyildir, əgər Allah-Təaladan olsaydı, bu ədədi əskik etməzdi.**

(كَذٰلِكَ يُضِلُّ اللّٰهُ مَنْ يَشَآءُ) **- Bu qeyd olunan zəlalət və hidayət kimi Allah-Təala kimi istəsə zəlalətdə qoyar,** (Allah-Təala öz ixtiyarları ilə küfr içində qalanlardan başqasını zəlalətdə görmək istəməz) **və kimə istəsə yardım edib, tövhid və islam tərəfinə hidayət edər.** (Öz ixtiyarları ilə islama daxil olanlara yardım edər).

(وَمَا يَعْلَمُ جُنُودَ رَبِّكَ اِلَّا هُوَ) - (Ey Məhəmməd), **sənin rəbbin Allah-Təalanın qoşunlarının sayına və keyfiyyətinə Allah-Təaladan başqa heç kim agah olmaz.** (Bu on doqquz nəfər cəhənnəm mühafizi Allah-Təalanın xüsusi qoşunudur. Bu ədədin sayındakı hikmətə Allah-Təala özü agahdır).

(وَمَا هِيَ اِلَّا ذِكْرٰى لِلْبَشَرِ) (Səqər) **adlı cəhənnəm odunun əzabını qeyd etməkdən məqsəd insanlardan ötrü öyüd-nəsihətdir ki, bəlkə əzabdan qorxub, çirkin əməlləri tərk etsinlər.**

**32-33) (كَلَّا) Amma insan nəsihət qəbul edən deyildir və heç bir şeyə baxıb ibrət almır.** (وَالْقَمَرِ ۙ وَالَّيْلِ اِذْ اَدْبَرَ) **And olsun aya və and olsun dönüb qayıdan gecəyə.**

وَالصُّبْحِ اِذَٓا اَسْفَرَۙ ﴿٣٤﴾ اِنَّهَا لَاِحْدَى الْكُبَرِۙ﴿٣٥﴾ نَذِيرًا لِلْبَشَرِۙ﴿٣٦﴾ لِمَنْ شَٓاءَ مِنْكُمْ اَنْ يَتَقَدَّمَ
اَوْ يَتَاَخَّرَ ؕ﴿٣٧﴾ كُلُّ نَفْسٍ بِمَا كَسَبَتْ رَهِينَةٌۙ ﴿٣٨﴾ اِلَّا اَصْحَابَ الْيَمِينِ ۠ۛ ﴿٣٩﴾ فِي جَنَّاتٍ ۠
ۛيَتَسَٓاءَلُونَۙ ﴿٤٠﴾ عَنِ الْمُجْرِمِينَۙ ﴿٤١﴾ مَا سَلَكَكُمْ فِي سَقَرَ﴿٤٢﴾ قَالُوا لَمْ نَكُ مِنَ الْمُصَلِّينَ
ۙ﴿٤٣﴾ وَلَمْ نَكُ نُطْعِمُ الْمِسْكِينَۙ ﴿٤٤﴾ وَكُنَّا نَخُوضُ مَعَ الْخَٓائِضِينَ ۙ﴿٤٥﴾ وَكُنَّا نُكَذِّبُ بِيَوْمِ
الدِّينِۙ﴿٤٦﴾ حَتّٰٓى اَتٰينَا الْيَقِينُ ؕ﴿٤٧﴾

---

**34-35) (وَالصُّبْحِ اِذَٓا اَسْفَرَۙ اِنَّهَا لَاِحْدَى الْكُبَرِۙ) - Və and olsun işıqlanmaqda olan sübh vaxtına, həqiqətən, Səqər adlanan cəhənnəm odunun əzabı böyük bəla və müsibətlərdən biridir ki, oraya düşən şəxsin xilas olması imkansızdır.**

**36) (نَذِيرًا لِلْبَشَرِۙ) Səqər böyük bəlalardan biri olub, insanları qorxutmaq üçündür ki, Allah-Təalaya asi olmasınlar.**

**37) (لِمَنْ شَٓاءَ مِنْكُمْ اَنْ يَتَقَدَّمَ اَوْ يَتَاَخَّرَ) Həm də o şəxslərdən ötrüdür ki, öz ixtiyarı ilə bir xeyir əmələ yönəlib, onu etsin, ya da ki, tərk etsin. Allah-Təala heç kimi xeyir, ya da şər əmələ məcbur edən deyildir.**

**38) (كُلُّ نَفْسٍ بِمَا كَسَبَتْ رَهِينَةٌۙ اِلَّا اَصْحَابَ الْيَمِينِ) Hər bir günahkar şəxs öz etdiyi xəbis əməlinin girovudur. Heç vaxt girovdan qurtulmayıb, əməlinə görə əzaba düçar olacaqdır. Ancaq sağ tərəfin əhli* gözəl əməllərinin səbəbinə özlərini pis əmələ görə girov olmaqdan xilas ediblər.**

(***Qeyd:** "Böyük şəxslər məclislərində özlərinə yaxın şəxslərə sağ tərəfdə yer verdikləri üçün Allah-Təala da cənnət əhlinin bir qismini onlara oxşadıb, onlara sağ tərəfin əhli deyir).

**40-42) (فِي جَنَّاتٍ ۠ ۛيَتَسَٓاءَلُونَۙ عَنِ الْمُجْرِمِينَۙ مَا سَلَكَكُمْ فِي سَقَرَ) Sağ tərəfin əhli vəsfə gəlməyən cənnətlərdə olub, bir-birlərindən soruşarlar ki, bəs asilərin əhvalından xəbərdarsınızmı? Onlar cavab verib deyərlər: "Bəli. Asilərdən soruşduq ki, sizi Səqər adlanan oda nə daxil etdi?**

**43) (قَالُوا لَمْ نَكُ مِنَ الْمُصَلِّينَۙ) - Onlar cavab verib dedilər: "Birincisi - biz dünyada namaz qılanlardan olmayıb, onun vacib və necə gözəl ibadət olmasına etiqad etmədik.**

**44) (وَلَمْ نَكُ نُطْعِمُ الْمِسْكِينَۙ) - Və ikincisi – ümmətin yoxsullarına yemək verən deyildik. Dünyada çox var-dövlət yığdıq. Ancaq özümüz yeyib, qarnımızı doldurub, kasıbları yada salmadıq.**

**45) (وَكُنَّا نَخُوضُ مَعَ الْخَٓائِضِينَۙ) - Və üçüncüsü – Qurana zidd, batil əməllərə dalanlarla birlikdə biz də batil işlərə daldıq.**

**46-47) (وَكُنَّا نُكَذِّبُ بِيَوْمِ الدِّينِۙ حَتّٰٓى اَتٰينَا الْيَقِينُ)** (Və dördüncüsü) **ölüm bizə**

فَمَا تَنْفَعُهُمْ شَفَاعَةُ الشَّافِعِينَ ﴿٤٨﴾ فَمَا لَهُمْ عَنِ التَّذْكِرَةِ مُعْرِضِينَ ﴿٤٩﴾ كَاَنَّهُمْ حُمُرٌ مُسْتَنْفِرَةٌ
﴿٥٠﴾ فَرَّتْ مِنْ قَسْوَرَةٍ ﴿٥١﴾ بَلْ يُرِيدُ كُلُّ امْرِئٍ مِنْهُمْ اَنْ يُؤْتٰى صُحُفًا مُنَشَّرَةً ﴿٥٢﴾ كَلَّا
بَلْ لَا يَخَافُونَ الْاٰخِرَةَ ﴿٥٣﴾ كَلَّا اِنَّهُ تَذْكِرَةٌ ﴿٥٤﴾ فَمَنْ شَٓاءَ ذَكَرَهُ ﴿٥٥﴾ وَمَا يَذْكُرُونَ اِلَّا
اَنْ يَشَٓاءَ اللّٰهُ

---

**gəlincəyə qədər cəza** (qiyamət) **gününü təkzib etdik, ancaq o zaman qiyamət gününün vaqe olması bizə aydın oldu.** (Burada cəhənnəm əhlinin sözü qurtardı).

**48) (فَمَا تَنْفَعُهُمْ شَفَاعَةُ الشَّافِعِينَ)** - (Ey Məhəmməd), **əgər bütün şəfaət edənlər Səqər adlı oda daxil olanlar üçün şəfaət etsələr, yenə onlara fayda verməyib, əzabdan xilas olmazlar. Çünki Allah-Təalanın qəzəbləndiyi şəxslərə şəfaətin faydası yoxdur.**

**49) (فَمَا لَهُمْ عَنِ التَّذْكِرَةِ مُعْرِضِينَ)** - (Ey Məhəmməd), **asilərdən ötrü belə bir əzab varkən, bəs müşriklərə nə olubdur ki, Qurani-Şərifin öyüd-nəsihətlərindən üz döndərib, qəbul etmirlər?**

**50-51) (كَاَنَّهُمْ حُمُرٌ مُسْتَنْفِرَةٌ فَرَّتْ مِنْ قَسْوَرَةٍ ) - Onlar Qurani-Şərifdən sanki ox atan bir qrup adamdan şiddətlə qaçan vəhşi ulaq kimi üz döndürüb qaçırlar.** (Müşriklər peyğəmbərə deyirdilər: "Bizim hər birimizin adına səmadan bir kitab gətirmədikcə, sənə iman etmərik, ancaq o zaman bəlkə sənə iman edərik. Növbəti ayə onların bu istəklərini rədd edir).

**52) (بَلْ يُرِيدُ كُلُّ امْرِئٍ مِنْهُمْ اَنْ يُؤْتٰى صُحُفًا مُنَشَّرَةً)** - (Ey Məhəmməd), **bəlkə müşriklərin arzusu odur ki, onların hər birinə ayrı bir səhifə, bir kitab verilib, öz adlarına nəşr olunsun. Onlar belə istəyirlər?**

**53) ( كَلَّا بَلْ لَا يَخَافُونَ الْاٰخِرَةَ) Heç vaxt onlara ayrı bir kitab verilməz. Bundan ötrü Qurandan üz döndərmirlər. Əksinə, axirətdən qorxmadıqlarına görə Quranın nəsihətlərinə etina etməyib, onu tərk edirlər.**

**54) (كَلَّا اِنَّهُ تَذْكِرَةٌ) - Müşriklərin Quranın öyüd-nəsihətlərinin haqlı olmasını inkar etməsi batildir, əksinə, həqiqətən, Quran kifayət edən bir nəsihətdir.**

**55) (فَمَنْ شَٓاءَ ذَكَرَهُ) Kim ki, öz ixtiyarı ilə istəyib, Qurana fikir verib, onun nəsihətlərindən mənfəət əldə etsə, onun mənfəəti öz nəfsinə aid olar.**

**56) (وَمَا يَذْكُرُونَ اِلَّا اَنْ يَشَٓاءَ اللّٰهُ) Allah-Təala özü onları imana gətirib, faydalanmağa vadar etmədikcə, müşriklər agah olub, Qurani-Şərifdən faydalanan deyildirlər.**

هُوَ اَهْلُ التَّقْوٰى وَاَهْلُ الْمَغْفِرَةِ ﴿٥٦﴾

---

**Belə iman gətirməyi də Allah-Təala istəməz və onlar da öz ixtiyarları ilə iman edən deyildirlər. (هُوَ اَهْلُ التَّقْوٰى وَاَهْلُ الْمَغْفِرَةِ) Allah-Təala bəndələrin ondan qorxub, asi olmayıb, iman etməsinə layiqdir, tövbə edənləri də bağışlamağa Allah-Təala layiqdir.**

Allah-Təalaya həmd olsun, əl-Muddəssir surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: “Kim əl-Muddəssir surəsini oxusa, Allah-Təala ona on savab bəxş edər.

## əl-QİYAMƏT SURƏSİ

75-ci surədir. Məkkədə nazil olub, 40 ayə, 199 kəlmə və 652 hərfdir.

لَآ اُقْسِمُ بِيَوْمِ الْقِيٰمَةِۙ ﴿١﴾ وَلَآ اُقْسِمُ بِالنَّفْسِ اللَّوَّامَةِ ﴿٢﴾ اَيَحْسَبُ الْاِنْسَانُ اَلَّنْ نَجْمَعَ عِظَامَهُ ۜ﴿٣﴾ بَلٰى قَادِرِينَ عَلٰٓى اَنْ نُسَوِّيَ بَنَانَهُ﴿٤﴾ بَلْ يُرِيدُ الْاِنْسَانُ لِيَفْجُرَ اَمَامَهُ ۚ﴿٥﴾

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)* (لَآ اُقْسِمُ بِيَوْمِ الْقِيٰمَةِۙ)**

**(*Qeyd:** *Təfsirçilərin əksəriyyəti "la" kəlməsini bu iki ayədə artıq sayıb, faydasını ancaq andı təkid etməyə məxsus ediblər. Lakin dürüst diqqət edəndə bunun bildiyimiz məna olmadığı görünür. Bəlkə əsl olan odur ki, peyğəmbər (ə.s) müşriklərə qiyamətin xüsusiyyətini və mütləq vaqe olacağını və insanların yenidən dirilib, qiyamət günündə cəzadan ötrü bir yerə toplanacaqlarını bəyan edir. Müşriklər bunu inkar edib, peyğəmbərlə istehza etdilər, o vaxt da bu mübarək surə nazil oldu, Allah-Təala öncə "la" kəlməsi ilə müşriklərin qiyaməti yox saymasını inkar edib, ondan sonra qiyamətin vaqe olacağına və insanı yenidən yaratmağa qadir olduğuna and içir. Bu mətləbə Zəməxşəri "Kəşşaf"da işarə edir).*

**2) (وَلَآ اُقْسِمُ بِالنَّفْسِ اللَّوَّامَةِ)** - (Ey Məhəmməd), **elə deyil ki, müşriklər deyir, bizim qüdrətimizi, insanı yenidən diriləcəyimizi və qiyamətin vaqe olacağını inkar edirlər. Əksinə, həqiqətən, vaqe olan qiyamətə və təqva sahibi olub, sahiblərinə məzəmmət edən nəfslərə and içirəm ki, əlbəttə yenidən dirilib, məsul olacaqsınız.**

**3) (اَيَحْسَبُ الْاِنْسَانُ اَلَّنْ نَجْمَعَ عِظَامَهُ ۜ) - Bəs insan** (qiyaməti inkar edənlər) **elə güman edir ki, onun sümükləri çürüyüb, torpağa qarışandan sonra biz onları bir yerə toplamağa qadir deyilik?**

**4) (بَلٰى قَادِرِينَ عَلٰٓى اَنْ نُسَوِّيَ بَنَانَهُ) - Əlbəttə, onun sümüklərini toplamağa qadir olub, toplayacağıq. Hətta onun barmaqlarının xırda sümüklərini də bir-birinə birləşdirib, əvvəlki halına gətirməyə qadirik.**

**5) (بَلْ يُرِيدُ الْاِنْسَانُ لِيَفْجُرَ اَمَامَهُ ۚ) - Bəlkə insanın arzusu odur ki, bundan sonra gələcək bütün ömrünü günahla məşğul olub, nəfsani istəklərini tərk etməsin? Yəqin bu səbəbdən qiyamətə etiqad etmək onun arzusuna münasib olmayıb, inkar edir.**

يَسْـَٔلُ اَيَّانَ يَوْمُ الْقِيٰمَةِ ﴿٦﴾ فَاِذَا بَرِقَ الْبَصَرُ ﴿٧﴾ وَخَسَفَ الْقَمَرُ ﴿٨﴾ وَجُمِعَ الشَّمْسُ وَالْقَمَرُ
﴿٩﴾ يَقُولُ الْاِنْسَانُ يَوْمَئِذٍ اَيْنَ الْمَفَرُّ ﴿١٠﴾ كَلَّا لَا وَزَرَ ﴿١١﴾ اِلٰى رَبِّكَ يَوْمَئِذٍ الْمُسْتَقَرُّ
﴿١٢﴾ يُنَبَّؤُا الْاِنْسَانُ يَوْمَئِذٍ بِمَا قَدَّمَ وَاَخَّرَ ﴿١٣﴾ بَلِ الْاِنْسَانُ عَلٰى نَفْسِهٖ بَصِيرَةٌ ﴿١٤﴾ وَلَوْ
اَلْقٰى مَعَاذِيرَهُ ﴿١٥﴾ لَا تُحَرِّكْ بِهٖ لِسَانَكَ لِتَعْجَلَ بِهٖ ﴿١٦﴾

---

**6) (يَسْـَٔلُ اَيَّانَ يَوْمُ الْقِيٰمَةِ) Küfr və inad üzrə olduğu yalan məqamında** (Ey Məhəmməd), **səndən soruşur: “Bu qiyamət ki, bizə xəbər verirsən, nə vaxt vaqe olacaqdır? Əgər doğrudursa, niyə vaqe olmur?**

**7-9) (فَاِذَا بَرِقَ الْبَصَرُ وَخَسَفَ الْقَمَرُ وَجُمِعَ الشَّمْسُ وَالْقَمَرُ)** - (Ey Məhəmməd), **qiyaməti inkar edənlərə de ki, o zaman ki, qorxudan göz bərəlib, heç bir şeyi dərk etmədi və ayın rəngi qaralıb işığı kəsildi, günəş və ay hər ikisi bir yerə gətirilib, birlikdə qaraldılar,** (Ayın nuru günəşdən olduğuna görə, elə ki, günəş qaraldı, ay da labüd qaralacaqdır), **belə vaxtda qiyamət vaqe olar.**

**10) (يَقُولُ الْاِنْسَانُ يَوْمَئِذٍ اَيْنَ الْمَفَرُّ) - Ogünkü gündə qiyaməti inkar edən insan əzabdan xilas olmağa heç bir çarə tapmayıb deyər: “Görəsən, qaçmağa yer hardadır ki, qaçıb əzabdan qurtulaq?**

**11) (كَلَّا لَا وَزَرَ) Yox, qaçmaq mümkün olmayıb, onlardan ötrü heç bir sığınacaq** (dağ, mağara, dərə, ağac) **olmaz ki, onlara pənah aparıb, əzabdan qaça bilsinlər.**

**12) (اِلٰى رَبِّكَ يَوْمَئِذٍ الْمُسْتَقَرُّ)** - (Ey Məhəmməd), **ogünkü gündə bütün bəndələrin qərargahı** (sığınacağı yer) **sənin rəbbin Allah-Təalanın tərəfinə olub, o günün hökmünü gözləyəcəklər.**

**13) (يُنَبَّؤُا الْاِنْسَانُ يَوْمَئِذٍ بِمَا قَدَّمَ وَاَخَّرَ)** - (Ey Məhəmməd), **ogünkü gündə insana dünyada yığdığı malından millət üçün sərf edib, özündən ötrü göndərdiyini və varislərindən ötrü dünyada qoyub, özü üçün günah və əzab saxladığını xəbər verirlər.** (O vaxt təmənni edər ki, kaş millətin mənafeyi üçün daha çox mal sərf edəydim).

**14) (بَلِ الْاِنْسَانُ عَلٰى نَفْسِهٖ بَصِيرَةٌ) - Əslində insan özü öz nəfsinə dəlil, şahid olub, öz əməllərinin hamısından agah olar.**

**15) (وَلَوْ اَلْقٰى مَعَاذِيرَهُ) - Əgər insan öz günahına görə hər cür üzrxahlıq etsə də, ondan qəbul olunmayacaqdır.** (Allah-Təaladan peyğəmbərə vəhy nazil olanda oxuyub, əzbərləmək üçün tələsirdi. Növbəti ayə tələsməsini qadağan edib, yavaş-yavaş, aramla hərəkət etməsi barəsində nazil oldu).

**16) (لَا تُحَرِّكْ بِهٖ لِسَانَكَ لِتَعْجَلَ بِهٖ)** - (Ey Məhəmməd), **Quranı oxuyub,**

اِنَّ عَلَيْنَا جَمْعَهُ وَقُرْاٰنَهُ ۚ ﴿١٧﴾ فَاِذَا قَرَاْنَاهُ فَاتَّبِعْ قُرْاٰنَهُ ۚ ﴿١٨﴾ ثُمَّ اِنَّ عَلَيْنَا بَيَانَهُ ۜ ﴿١٩﴾ كَلَّا بَلْ تُحِبُّونَ الْعَاجِلَةَ ۙ ﴿٢٠﴾ وَتَذَرُونَ الْاٰخِرَةَ ۜ ﴿٢١﴾ وُجُوهٌ يَوْمَئِذٍ نَاضِرَةٌ ۙ ﴿٢٢﴾ اِلٰى رَبِّهَا نَاظِرَةٌ ۚ ﴿٢٣﴾ وَوُجُوهٌ يَوْمَئِذٍ بَاسِرَةٌ ۙ ﴿٢٤﴾ تَظُنُّ اَنْ يُفْعَلَ بِهَا فَاقِرَةٌ ۜ ﴿٢٥﴾ كَلَّا اِذَا بَلَغَتِ التَّرَاقِيَ ۙ ﴿٢٦﴾ وَقِيلَ مَنْ ۜ رَاقٍ ۙ ﴿٢٧﴾

**əzbərləmək üçün tələsib, dilini qımıldadıb, tez-tez oxuma. Əksinə, bizim tərəfimizdən nazil olan vəhyə aramla qulaq as.**

**17) (اِنَّ عَلَيْنَا جَمْعَهُ وَقُرْاٰنَهُ ۚ) Həqiqətən, Quranın ehkamını sənin qəlbində toplayıb, sənin dilində oxutmaq bizim öhdəmizdədir. Quranın bir kəlməsi və bir hərfi səndən qeyb olmayıb, hamısına agah olacaqsan.**

**18) (فَاِذَا قَرَاْنَاهُ فَاتَّبِعْ قُرْاٰنَهُ) -** (Ey Məhəmməd), **tələsməyib, səbir et, o zaman ki, biz Quranın ayələrini sənə oxuyub qurtardıq, o vaxt sən də o oxunuşa tabe olub oxu. Hamısı sənin əzbərində olar, unutmazsan.**

**19) (ثُمَّ اِنَّ عَلَيْنَا بَيَانَهُ) - Əzbərləyəndən sonra əgər bir şey sənə çətin olsa, onu bəyan etmək bizim öhdəmizdədir. Səndən ötrü bəyan edərik.**

**20) (كَلَّا) -** (Ey Məhəmməd), **əlbəttə hər bir işdə tələsməkdən çəkinib, hər bir işə aramla yönəlməyi özünə şüar et. (بَلْ تُحِبُّونَ الْعَاجِلَةَ)**

**21) (وَتَذَرُونَ الْاٰخِرَةَ ۜ) Tələsən təkcə peyğəmbərimiz** (Məhəmməd) **deyildir. Əksinə, siz insanların hamısı axirətdən əvvəl olduğu üçün dünya işində tələsməyi sevib, axirəti tərk edirsiniz.**

**22) (وُجُوهٌ يَوْمَئِذٍ نَاضِرَةٌ) - Və halbuki qiyamət günündə insanların üzləri iki cür olar, bir qismi** (möminlərin üzləri) **təptəzə, gözəl və nurani olar.**

**23) (اِلٰى رَبِّهَا نَاظِرَةٌ) - Bu üzlərin sahibləri ancaq öz rəbləri Allah-Təalanın əzəmət və qüdrətinə, səltənət və hakimiyyətinə tamaşa edib, digər nemətlərdən qafil olarlar.**

**24) (وَوُجُوهٌ يَوْمَئِذٍ بَاسِرَةٌ) - İkinci qisim üzlər** (asilərin üzləri) **o üzlərdir ki, qiyamət günündə nemətdən məhrum olub, şiddətlə qaralıb, üzlərində qəm və hüzn peyda olar.**

**25) (تَظُنُّ اَنْ يُفْعَلَ بِهَا فَاقِرَةٌ) - O üzlərin sahibləri bel sümüklərini sındıran bəla və fəlakətin onlara vaqe olmasına agah olub, onu gözləyərlər.**

**26-27) (كَلَّا) Heç vaxt dünyanı axirətə üstün saymaq olmaz, hər bir halda ölüm sizə gəlib, dünya sizdən ayrılacaqdır. Dünya malından nə qədər sərf edib, millətin övladlarına yardım etsəniz, o, sizə fayda verəndir. Ondan başqası sizə heç bir fayda verməz. (اِذَا بَلَغَتِ التَّرَاقِيَ ۙ وَقِيلَ مَنْ ۜ رَاقٍ) - O zaman ki, insanın ölümü yaxınlaşıb, ruhu boynunun sümüklərinə** (boğa-

وَظَنَّ اَنَّهُ الْفِرَاقُ ۙ ﴿٢٨﴾ وَالْتَفَّتِ السَّاقُ بِالسَّاقِ ۙ ﴿٢٩﴾ اِلٰى رَبِّكَ يَوْمَئِذٍ الْمَسَاقُ ۜ ﴿٣٠﴾ فَلَا
صَدَّقَ وَلَا صَلّٰى ۙ ﴿٣١﴾ وَلٰكِنْ كَذَّبَ وَتَوَلّٰى ۙ ﴿٣٢﴾ ثُمَّ ذَهَبَ اِلٰٓى اَهْلِه۪ يَتَمَطّٰى ۜ ﴿٣٣﴾ اَوْلٰى لَكَ
فَاَوْلٰى ۙ ﴿٣٤﴾ ثُمَّ اَوْلٰى لَكَ فَاَوْلٰى ۜ ﴿٣٥﴾ اَيَحْسَبُ الْاِنْسَانُ اَنْ يُتْرَكَ سُدًى ۜ ﴿٣٦﴾ اَلَمْ يَكُ نُطْفَةً
مِنْ مَنِيٍّ يُمْنٰى ۙ ﴿٣٧﴾ ثُمَّ كَانَ عَلَقَةً فَخَلَقَ فَسَوّٰى ۙ ﴿٣٨﴾

---

zına) **çatdı, o zaman onun yanında hazır olan** (yaxın şəxslər – ata, ana, oğul və ya qohum-əqrəbası) **ondan ötrü çarə axtarıb, bir-birilərinə deyərlər: “Necə edək, görəsən, bir həkim, ya başqa birisi var ki, buna şəfa verib ölməkdən qorusun?**

**28) (وَظَنَّ اَنَّهُ الْفِرَاقُ) - Ölüm halında olan şəxs özü anlayır ki, artıq sevdiyi dünya malından və övladdan ayrılmaq zamanıdır, ölümü təxirə salmağa nə qohum-əqrəbası və nə də özü bir çarə tapa bilməz.**

**29) (وَالْتَفَّتِ السَّاقُ بِالسَّاقِ ۙ) - Ölümün şiddəti ilə dünyadan ayrılmanın şiddəti (qorxusu) bir-birinə qarışıb, dünyadan ayrılmamış ona əzab vaqe olar.**

**30) (اِلٰى رَبِّكَ يَوْمَئِذٍ الْمَسَاقُ)** - (Ey Məhəmməd), **ogünkü gündə** (dünyadan ayrılan gündə) **bütün insanların qayıdacağı yer sənin rəbbin Allah-Təala tərəfinə olub, hamısını onun hökmünə tərəf sürüyüb aparарlar.**

**31) (فَلَا صَدَّقَ وَلَا صَلّٰى ۙ) - İnsana edilən bu əzabların və əzabla can verməsinin səbəbi odur ki, nə bizim tərəfimizdən gələn peyğəmbərləri və Quranı təsdiq etdi və nə də dinin sütunu olan namazı qıldı.**

**32) (وَلٰكِنْ كَذَّبَ وَتَوَلّٰى ۙ) - Əksinə Quranı təkzib edib, iman etməkdən və təsdiq etməkdən üz döndərdi.**

**33) (ثُمَّ ذَهَبَ اِلٰٓى اَهْلِه۪ يَتَمَطّٰى ۜ) Haqqdan üz döndərəndən sonra dünya malına etimad edib, təkəbbür və qürurla ailəsinin yanına gedib eyş-işrətlə məşğul olar.**

**34) (اَوْلٰى لَكَ فَاَوْلٰى ۙ) Ey haqqı inkar edib, üz döndərən insan, sənə əzab ancaq layiqdir.**

**35) (ثُمَّ اَوْلٰى لَكَ فَاَوْلٰى ۜ) - Ondan sonra yenə sənə əzab layiqdir** (Əzabın mütləq olacağını bildirmək üçün ayə təkrar edilir).

**36) (اَيَحْسَبُ الْاِنْسَانُ اَنْ يُتْرَكَ سُدًى ۜ) - Bəlkə insan elə güman edir ki, özbaşına buraxılıb, onun barəsində bir əmr və qadağa olmayıb, yenidən dirilib, dünyada etdiyi əməllərinin cəzası ona verilməyəcəkdir?**

**37) (اَلَمْ يَكُ نُطْفَةً مِنْ مَنِيٍّ يُمْنٰى ۙ) - Bəs insanın əsli ana bətninə tökülən bir damcı spermadan ibarət deyilmi?**

فَجَعَلَ مِنْهُ الزَّوْجَيْنِ الذَّكَرَ وَالْاُنْثٰىۜ ﴿٣٩﴾ اَلَيْسَ ذٰلِكَ بِقَادِرٍ عَلٰٓى اَنْ يُحْيِيَ الْمَوْتٰى ﴿٤٠﴾

---

**38) (ثُمَّ كَانَ عَلَقَةً فَخَلَقَ فَسَوّٰىۙ) - Ondan sonra sperma dönüb laxtalanmış qan olar, Allah-Təala o qandan əzası yerində olan, gözəl surətdə bir insan yaradar.** (Bu sizin əslinizdir, belə əsldən sizi yaratmağa qadir olan Allah-Təala yenidən yaradıb, diriltməyə də qadir olar).

**39) (فَجَعَلَ مِنْهُ الزَّوْجَيْنِ الذَّكَرَ وَالْاُنْثٰىۜ) Allah-Təala öz kamil qüdrəti ilə o insandan iki cinc - bir kişi, bir qadın yaratdı ki, dünyanın işləri tamamlansın.**

**40) (اَلَيْسَ ذٰلِكَ بِقَادِرٍ عَلٰٓى اَنْ يُحْيِيَ الْمَوْتٰى) - Bəs belə bir qüdrət sahibi olan Allah-Təala ölülərə yenidən həyat verib, diriltməyə qadir deyilmi? Daha əvvəl yaratmağa qadir olan Allah-Təala axırda da yaratmağa qadir olacaqdır.**

Allahın Rəsulu (ə.s) nə zaman bu axırıncı ayəni oxusa deyərdi: “İlahi, hər bir eyib və nöqsandan pak və ucasan, ölüləri yenidən diriltməyə də əlbəttə, qadirsən. Biz də deyirik ki, ilahi, insan nəslini yoxluqdan yaradıb, onu dünyada ağıl, şüur sahibi edəndən sonra cəhalət və nadanlıqla ölən nəfsləri elm və maarif nuru ilə yenidən diriltməyə də əlbəttə qadirsən. Qiyamət surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: “Kim Qiyamət surəsini oxusa, mən və Cəbrayıl (Ruhülmüqəddəs) qiyamət günündə ondan ötrü şəhadət edərik ki, bu şəxs qiyamət gününü təsdiq edib, iman etmişdi.

## əl-İNSAN SURƏSİ

76-cı surədir. Mədinədə nazil olub, 31 ayə, 240 kəlmə və 1054 hərfdir.

هَلْ اَتٰى عَلَى الْاِنْسَانِ حِينٌ مِنَ الدَّهْرِلَمْ يَكُنْ شَيْئًا مَذْكُورًا ﴿١﴾ اِنَّا خَلَقْنَا الْاِنْسَانَ مِنْ نُطْفَةٍ اَمْشَاجٍ نَبْتَلِيهِ فَجَعَلْنَاهُ سَمِيعًا بَصِيرًا ﴿٢﴾ اِنَّا هَدَيْنَاهُ السَّبِيلَ اِمَّا شَاكِرًا وَاِمَّا كَفُورًا ﴿٣﴾ اِنَّٓا اَعْتَدْنَا لِلْكَافِرِينَ سَلَاسِلَاْ وَاَغْلَالًا وَسَعِيرًا﴿٤﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (هَلْ اَتٰى عَلَى الْاِنْسَانِ حِينٌ مِنَ الدَّهْرِلَمْ يَكُنْ شَيْئًا مَذْكُورًا)** - (Ey Məhəmməd), **həqiqətən, dünyada insanın (insan nəslinin) mövcud olmasından əvvəl elə bir uzun zaman gəlib-keçibdir ki, o zaman insan atalarının belində sperma kimi qeyd olunmağa layiq bir şey olmayıbdır. İnsanı o haldan meydana gətirib, gözəl surətə daxil etmişik.**

**2) (اِنَّا خَلَقْنَا الْاِنْسَانَ مِنْ نُطْفَةٍ اَمْشَاجٍ نَبْتَلِيهِ فَجَعَلْنَاهُ سَمِيعًا بَصِيرًا)** - (Ey Məhəmməd), **həqiqətən, biz insanı ata və ananın bir-birinə qarışan spermasından yaradıb, dünya və axirət işlərinə düçar edərik və bu səbəbdən insanı eşidən qulaq və görən göz sahibi etdik.**

**3) (`اِنَّا هَدَيْنَاهُ السَّبِيلَ اِمَّا شَاكِرًا وَاِمَّا كَفُورًا) - İnsanı eşidən qulaq və görən göz sahibi etməkdən əlavə ona bir nur (ağıl) vermişik ki, həqiqətən, o ağlın səbəbinə haqq və batil yolunu ondan ötrü bəyan edib, xeyir və şəri ona göstərdik. Hidayətdən sonra öz ixtiyarı ilə ya şükür edən müvəhhid və ya kafir olub müşrik olacaqdır.**

**4) (اِنَّٓا اَعْتَدْنَا لِلْكَافِرِينَ سَلَاسِلَاْ وَاَغْلَالًا وَسَعِيرًا) Həqiqətən, biz kafirlərdən ötrü əllərini boyunlarına bağlamaq üçün zəncirlər və şiddətli alov hazırlamışıq.** (Zəməxşəri "Kəşşaf"da, şeyx Təbərsi "Məcməül-bəyan"da, Fazil Əlaəddin Sufi Xazin "Lübabüt-təvil"də, Abdullah ibn Mahmud Nəsəfi "Mədarikütt-ənzil"də və bunlardan başqa digər təfsirçilər İbn Abbasdan rəvayət ediblər: "Həsən və Hüseyn uşaqkən xəstələndilər. Peyğəmbər (ə.s) bəzi səhabələrlə onların ziyarətinə getdi. Əhvallarını soruşandan sonra buyurdu: "Ey Əli, oğlanlarının şəfasından ötrü nəzir versən, gözəl olar. Əli, Fatimeyi-Zəhra, bir də kənizləri Fizzə Allah-Təala Həsənlə Hüseynə şəfa verəndən sonra üç gün oruc tutmağı nəzir etdilər. Elə ki, Allah-Təala onlara şəfa verdi, əhdlərinə vəfa edib, oruc tutmağa başladılar. Lakin iftar etməyə, yeməyə bir şeyləri yox idi, Əli (ə.s) Xeybər əhlindən olan Şəmun adlı yəhudidən üç sa` (1 sa` – 3261, 5 qr) arpa borc aldı. Hz. Fatimeyi-Zəhra arpanın bir sa`-sını özü dəyirmanda un edib, iftardan

إِنَّ الْأَبْرَارَ يَشْرَبُونَ مِنْ كَأْسٍ كَانَ مِزَاجُهَا كَافُورًا﴿٥﴾ عَيْنًا يَشْرَبُ بِهَا عِبَادُ اللّٰهِ يُفَجِّرُونَهَا تَفْجِيرًا﴿٦﴾

---

ötrü beş ədəd çörək pişirib hazır etdi. İftar zamanı olub iftardan ötrü çörəkləri qabaqlarına qoydular. Dərhal bir dilənçi qapıdan səsləndi: "Səlamün-əleyküm, ey Məhəmmədin əhli-beyti, kasıb bir müsəlmanam, mənə yemək verin, Allah-Təala da sizi cənnət süfrəsindən yedizdirsin. Əli, Fatimeyi-Zəhra, Həsən, Hüseyn, kənizləri Fizzə - beşi də yeməklərini o kasıba verib, sudan başqa heç bir şey dadmayıb, həmin halda gecəni sabaha qədər qalıb, oruc tutdular. Arpanın ikinci sa`-sından Hz. Fatimeyi-Zəhra yenə beş ədəd çörək hazırlayıb, iftar zamanında qabaqlarına qoydular. Əllərini yeməyə uzatmamış qapıdan bir nəfər salam deyib səsləndi: "Yetim bir müsəlmanam, mənə yemək verin. Hamısı yenə yeməklərini ona verib, su ilə iftarlarını açdılar. Üç gün dalbadal oruc tutmağa nəzir etdiklərinə görə ertəsi günü yenə həmin halda oruc tutdular. Hz. Məryəm kimi pak olan Hz. Fatimeyi-Zəhra arpanın üçüncü sa`-sından yenə beş ədəd çörək hazırladı. İftar zamanında qapıdan bir nəfər səsləndi: "Ey Məhəmmədin əhli-beyti, mən bir əsirəm. Mənə yemək verin, yenə o beş nəfər yeməklərini ona verib, gecə ac yatdılar. Elə ki, səhər oldu, Əli (ə.s) Həsənlə Hüseynin əlindən tutub, peyğəmbərin hüzuruna getdi. Peyğəmbər Həsənlə Hüseynin şiddətli aclıqdan cücə kimi titrədiyini görəndə buyurdu: "Sizi bu halda görməyim məni çox qəmgin etdi. Ayağa durub onlarla birlikdə Fatimənin yanına gedib gördü ki, Fatimeyi-Zəhra da elə bir haldadır ki, acından qarnı belinə yapışıb, gözləri çuxura düşüb, ibadətlə məşğuldur. Bu hal peyğəmbəri daha çox qəmgin etdi. Onların bu əməlləri Allah-Təalaya agah olub, onları nə qədər bəyənməsi haqqında bundan sonra gələn on yeddi ayəni dərhal peyğəmbərə nazil etdi. Ayələrdə onların bu əməllərinin şanı və dərəcəsi və axirətdəki əcr-muzdları göstərilməklə birlikdə islam ümmətindən ötrü də əbədi bir nümunə verilibdir.

**5) (إِنَّ الْأَبْرَارَ يَشْرَبُونَ مِنْ كَأْسٍ كَانَ مِزَاجُهَا كَافُورًا)** - (Ey Məhəmməd), **həqiqətən, bu xeyir əməl** (çörək vermək) **sahibləri** (Əli, Fatimeyi-Zəhra, Həsən, Hüseyn, Fizzə) **hansı ki, üç gün iftarsız oruc tutub, xüsusən orucun susuzluğuna səbir etdilər, onun əvəzinə axirətdə büllur qədəhin içində bir növ şərab içərlər ki, onun sərinliyi susuzluq atəşini elə yatırar ki, sanki, ona kafur qarışdırılmışdır.** (Kafur son dərəcə soyuq olub və ərəblər arasında sərinlikdə zərb-məsəl olması səbəbi ilə Allah-Təala onların adət-ənənələrinə görə axirət şərabının sərinliyini anlatmaq üçün bu şərabın kafur ilə qarışdırılmış olmasını qeyd etdi).

**6) (عَيْنًا يَشْرَبُ بِهَا عِبَادُ اللّٰهِ يُفَجِّرُونَهَا تَفْجِيرًا) - Büllur qədəhdə içilən şərab elə bir çeşmənin şərabıdır ki, xeyir əməl sahibi olan Allah-Təala bəndələri** (o beş nəfər və onların yoluna tabe olanlar) **o çeşmədən içib, o çeşməni asanlıqla hər bir tərəfə çəkib apara bilərlər.**

يُوفُونَ بِالنَّذْرِ وَيَخَافُونَ يَوْمًا كَانَ شَرُّهُ مُسْتَطِيرًا ﴿٧﴾ وَيُطْعِمُونَ الطَّعَامَ عَلٰى حُبِّهِ مِسْكِينًا وَيَتِيمًا
وَاَسِيرًا ﴿٨﴾ اِنَّمَا نُطْعِمُكُمْ لِوَجْهِ اللّٰهِ لَا نُرِيدُ مِنْكُمْ جَزَٓاءً وَلَا شُكُورًا ﴿٩﴾ اِنَّا نَخَافُ مِنْ رَبِّنَا
يَوْمًا عَبُوسًا قَمْطَرِيرًا ﴿١٠﴾ فَوَقٰيهُمُ اللّٰهُ شَرَّ ذٰلِكَ الْيَوْمِ وَلَقّٰيهُمْ نَضْرَةً وَسُرُورًاۚ ﴿١١﴾ وَجَزٰيهُمْ بِمَا
صَبَرُوا جَنَّةً وَحَرِيرًاۙ ﴿١٢﴾ مُتَّكِـِٔينَ فِيهَا عَلَى الْاَرَٓائِكِۚ لَا يَرَوْنَ فِيهَا شَمْسًا وَلَا زَمْهَرِيرًاۚ ﴿١٣﴾
وَدَانِيَةً عَلَيْهِمْ ظِلَالُهَا وَذُلِّلَتْ قُطُوفُهَا تَذْلِيلًا ﴿١٤﴾

---

**7) (يُوفُونَ بِالنَّذْرِ وَيَخَافُونَ يَوْمًا كَانَ شَرُّهُ مُسْتَطِيرًا) - O beş nəfərin xüsusiyyəti budur ki, nəzirlərinə** (üç gün oruc tutmağa) **vəfa edib, şəri açıq-aydın yayğın olan o günün** (qiyamət gününün) **əzabından qorxub, gecələri ac yatıb, üç gün oruc tutdular.**

**8) (وَيُطْعِمُونَ الطَّعَامَ عَلٰى حُبِّهِ مِسْكِينًا وَيَتِيمًا وَاَسِيرًا) - Onların yeməyə ehtiyacları və istəkləri olduğu halda yeməklərini** (ilk gün) **yoxsula,** (ikinci gün) **yetimə,** (üçüncü gün) **əsirə verib, onları özlərindən üstün sayıb, özləri aclığa səbir etdilər.** (Bu, səxavətin, comərdliyin də üstündə olan "isar"dır - bağışlamadır).

**9) (اِنَّمَا نُطْعِمُكُمْ لِوَجْهِ اللّٰهِ لَا نُرِيدُ مِنْكُمْ جَزَٓاءً وَلَا شُكُورًا) - O beş nəfər** (yoxsula, yetimə və əsirə) **yemək verəndə onlara dedilər ki, biz sizə yemək verməklə sizdən nə bir əvəz və də nə bizə mədh edib dua etmənizi istəmirik. Ancaq Allah-Təalanın məmnunluğundan ötrü sizə yemək veririk.**

**10) (اِنَّا نَخَافُ مِنْ رَبِّنَا يَوْمًا عَبُوسًا قَمْطَرِيرًا) Həqiqətən, insanların o günün qorxusundan üzlərinin bürüşüb, qəm-qüssəyə büründüyü şiddətli bir əzab günündə** (qiyamət günündə) **biz rəbbimiz Allah-Təaladan qorxub, sizə yemək veririk ki, bəlkə bizə o günün əzabından nicat versin, başqa bir niyyətlə sizə yemək vermirik.**

**11) (فَوَقٰيهُمُ اللّٰهُ شَرَّ ذٰلِكَ الْيَوْمِ وَلَقّٰيهُمْ نَضْرَةً وَسُرُورًاۚ) - Onların bu qorxusuna görə Allah-Təala onları o günün** (qiyamət gününün) **şərindən qoruyub, qəm-qüssə əvəzinə qəlblərinə sevinc, üzlərinə təbəssüm bəxş edəcəkdir.**

**12) (وَجَزٰيهُمْ بِمَا صَبَرُوا جَنَّةً وَحَرِيرًاۙ) - Onlar orucun aclığına və susuzluğuna səbir etdiklərinə görə Allah-Təala cənnəti onlara verib** (hansı ki, orada nə isti və nə də soyuq olmaz) **və o cənnətdə onlara ipək libas geydirəcəkdir.**

**13) (مُتَّكِـِٔينَ فِيهَا عَلَى الْاَرَٓائِكِۚ لَا يَرَوْنَ فِيهَا شَمْسًا وَلَا زَمْهَرِيرًاۚ) - O cənnətdə taxtlara söykənib, elə bir halda bir-birləri ilə söhbətlə məşğul olarlar ki, orada nə istilik və nə də soyuğu görməzlər.**

**14) (وَدَانِيَةً عَلَيْهِمْ ظِلَالُهَا وَذُلِّلَتْ قُطُوفُهَا تَذْلِيلًا) - O cənnət ağaclarının budaqları onlara elə yaxın olar ki, o ağacların meyvələrini dərmək onlardan ötrü asan olub, hər bir halda o meyvələrdən dərib, yeyə bilərlər.** (Hərçənd cən-

وَيُطَافُ عَلَيْهِمْ بِاٰنِيَةٍ مِنْ فِضَّةٍ وَاَكْوَابٍ كَانَتْ قَوَارِيرَاۙ ﴿١٥﴾ قَوَارِيرَ مِنْ فِضَّةٍ قَدَّرُوهَا تَقْدٖيرًا ﴿١٦﴾ وَيُسْقَوْنَ فٖيهَا كَأْسًا كَانَ مِزَاجُهَا زَنْجَبٖيلًاۚ ﴿١٧﴾

---

nətdə ağac kölgəsinə ehtiyac olmayacaqdır, lakin ağacın xüsusiyyəti gündə kölgə salmaq olduğuna görə burada kölgə ifadəsi qeyd olundu).

**15-16) (وَيُطَافُ عَلَيْهِمْ بِاٰنِيَةٍ مِنْ فِضَّةٍ وَاَكْوَابٍ كَانَتْ قَوَارِيرَاۙ) - Cənnətdə xidmətçilər dolanıb onlara gümüş qədəhlərdə, büllur kuzələrdə hər bir növ içəcəyi içizdirərlər.** (قَوَارِيرَ مِنْ فِضَّةٍ قَدَّرُوهَا تَقْدٖيرًا) **- O büllur kuzələr gümüşdən yaradılıb,** (yəni Allah-Təala o büllurları gümüşdən yaradıb), **gümüşün ağlığıyla bülların saflığı birləşib. Onların öz istədikləri şəkildə Allah-Təala onlardan ötrü o kuzələri yaradar.**

**17) (وَيُسْقَوْنَ فٖيهَا كَأْسًا كَانَ مِزَاجُهَا زَنْجَبٖيلًاۚ) Yenə büllur* qədəhlərdə onlara elə bir şərab verilər ki, sanki ona zəncəfil qarışdılıb, zəncəfil dadı verər.** (Ərəblər arasında zəncəfil ləziz və ətirli bir şey hesab olunurdu. Həqiqətən, onun ağzı yandıran tünd acı dadı var).

**(*Qeyd:** *Büllur lətif və zərif olub içindəkini hər bir şeydən daha saf göstərdiyi və gözəl olduğu üçün Allah-Təala cənnət qədəhlərini büllurdan yaradıb. Ömər ibn Xəttabın xəlifəliyi zamanında islam qaziləri (Şüştər) Tüstər məmləkətini fəth edib, o diyarın Hürmüzan adlı sultanını öz xahişiylə xəlifənin hüzuruna göndərdilər. Hürmüzan var-dövləti, xidmətçiləri ilə, qızıl və cəvahiratla bəzənmiş libaslarla Mədinəyə daxil oldu. Mədinə əhli onun var-dövlətinə və libasına baxıb təəccüb edirdilər. Həmin libasla xəlifənin hüzuruna daxil olmağa izin istədi. Xəlifə o libasla daxil olmağa izin vermədi. Libasını dəyişəndən sonra səhabələr də xəlifənin hüzurunda olan halda Hürmüzana izin verilib, o da daxil oldu. Bir qədər danışıqdan sonra Hürmüzan su istədi. Bir ağac qabın içində ona su gətirdilər. Hürmüzan belə qablarda su içmərik, deyib o qabı rədd etdi. Əli ibn Əbu Talib buyurdu ki, büllur qabda su gətirsinlər. Hürmüzan gətirilən suyu alıb, əlində tutub dayandı, xəlifə baxıb gördü ki, Hürmüzan suyu içmir. Buyurdu: "Niyə su içmirsən? Hürmüzan dedi: "Qorxuram ki, bu suyu içən kimi məni qətl edəsən. Xəlifə buyurdu: "Səni niyə qətl edim? Qətl edilməyəcəksən. Hürmüzan dedi: "Gərək bu şəkildə and içəsən ki, nə qədər ki, bu suyu içməyibsən, səni qətl etməyəcəm. Xəlifə dedi: vallah, nə qədər ki, o suyu içməyibsən, səni qətl etməyəcəm. Dərhal Hürmüzan o büllur qabı yerə çırpıb sındırdı. Hər kəs təəccübləndi. Hürmüzan dedi: "Ey xəlifə, bu su töküldü, artıq içilməyəcəkdir, sən də məni qətl etməyə qadir deyilsən. İndi mən öz ixtiyarımla, heç bir qorxu və təzyiq olmadan islama daxil oldum. Firuz (iranlı) xəlifə Ömər ibn Xəttabı qətl edincəyə qədər Hürmüzan Mədinədə yaşadı. Xəlifənin Übeydullah adlı oğlu Firuz Hürmüzan yanına gəlib-gedib, atasını onun əmri ilə öldürməsi ittihamı ilə Hürmüzanı günahkar sayıb, onu qətl etdi. Elə ki, Osman ibn Əffan xəlifə oldu, Əli ibn Əbu Talib Osmandan Hürmüzanın qisasını*

عَيْنًا فِيهَا تُسَمَّىٰ سَلْسَبِيلًا ﴿١٨﴾ وَيَطُوفُ عَلَيْهِمْ وِلْدَانٌ مُّخَلَّدُونَ إِذَا رَأَيْتَهُمْ حَسِبْتَهُمْ لُؤْلُؤًا مَّنثُورًا ﴿١٩﴾

*Übeydullahdan almasını istəyib dedi: "O kişi müsəlman idi, səbəbsiz, nahaq yerə Übeydullah onu qətl etdi. Gərək Übeydullahdan qisas alınıb, qətl olunsun. Osman xəlifəliyə təzə başlamasını bəhanə edib, qisas almaqdan çəkindi. Elə ki, Əli ibn Əbu Talib xəlifə oldu, Übeydullah qisas alınacağını anlayıb, Şama, Müaviyənin yanına getdi. Lakin tale onu Siffin savaşına sövq edib, o savaşda Əli ibn Əbu Talibin tərəfdarları tərəfindən cəzalandırılıb, öldürüldü).*

**18) (عَيْنًا فِيهَا تُسَمَّىٰ سَلْسَبِيلًا) Zəncəfil dadında olan içəcək cənnətdə bir çeşmədir, o çeşmədə zəncəfilin (tünd acılığı) olmayıb, dadlı olub, içərkən boğazdan rahat keçdiyi üçün "səlsəbil"** (ləziz su) **adlanır.**

**19) (وَيَطُوفُ عَلَيْهِمْ وِلْدَانٌ مُّخَلَّدُونَ إِذَا رَأَيْتَهُمْ حَسِبْتَهُمْ لُؤْلُؤًا مَّنثُورًا) - Davamlı onların ətrafında xidmət üçün həmişəcavan yeniyetmələr dolanarlar.** (Ey Məhəmməd), **o zaman ki, onları gördün, rənglərinin saflığından və parlaqlığından sanki sədəfdən təzə çıxıb, yer üzünə dağılmış mirvari* olduqlarını zənn edərsən.**

**(*Qeyd:** *Dənizdən təzə çıxarılan mirvari sədəf içində olub hava, ya da tozdan qorunmuş olduğu üçün rəngi saf, parlaq, gözləri qamaşdırar. Ondan sonra ona hava dəydiyinə görə tozdan rəngi dəyişib, əvvəlki parlaqlığı və saflığı gedib, rəngi bulanıqlaşar və saralar. Bu səbəbdən adət-ənənədə, şeir və nəsrdə hər bir saf və parlaq şeyi və gözəl surətləri dənizdən təzə çıxan mirvariyə bənzədərlər. Allah-Təala da Qurani-Şərifdə adət-ənənə üzrə xitab edib, cənnətin həmişəcavan xidmətçilərini gözəllikdə sədəfdən təzə çıxarılan mirvariyə oxşadır. Ərəb kəlamında, xüsusən şairlərin şeirlərində belə oxşatmalar çox vaqe olubdur. Həsən ibn Səhl Sərəxsi Buran adlı qızını xəlifə Məmunla evləndirib, onun toyunda saysız-hesabsız bəxşiş verdi. Zifaf gecəsində otağı qızılı saplarla toxunan xalılarla döşənib, sarayın xanımları xalıların, döşəyin üstünə də mirvari səpmişdilər. Elə ki, Məmun otağa daxil olub, mirvari ilə bəzədilmiş döşəyi gördü, o mənzərədən xoşu gəlib dedi: "Əbu Nüveysin hər bir xeyri Allah-Təala içün olsun, sanki bu mənzərəni görmüş kimi deyib: "Şərabın üzərində olan qabarcıqlar sanki qızıldan yer üzünə saçılan inci dənələri kimidir". Əbu Nüveys islamın böyük şairlərindən olub, lakin əyyaş olduğundan bu şeirində cama tökülən zaman şərabın üzərində əmələ gələn qabarcıqları belə vəsf edir. Belə bənzərliklər ərəb kəlamında çoxdur. Həsən ibn Səhl qardaşı Fəzl ibn Səhldən sonra Məmuna vəzir oldu. Bu iki qardaş xüsusən, Fəzl elm və fəzilətdə nadir şəxslər idilər. Sərəxsi türkdür. Məmunun kəniz olan anası da türk olduğu üçün türklər Məmuna yardım etdi, o da Mərvdən Bağdada Tahir ibn Hüseynin rəhbərliyində qoşun göndərib qardaşı Əmin Zübeydə oğlunu qətl edib, xəlifə oldu. Türklərə etimad edib Mərvi xəlifəliyin mərkəzi etdi. Məmun hər bir elmə agah olub, fəlsəfəni də yaxşı bilirdi).*

وَاِذَا رَاَيْتَ ثَمَّ رَاَيْتَ نَعٖيمًا وَمُلْكًا كَبٖيرًا ﴿٢٠﴾ عَالِيَهُمْ ثِيَابُ سُنْدُسٍ خُضْرٌ وَاِسْتَبْرَقٌۘ وَحُلُّوٓا اَسَاوِرَ
مِنْ فِضَّةٍۚ وَسَقٰيهُمْ رَبُّهُمْ شَرَابًا طَهُورًا ﴿٢١﴾ اِنَّ هٰذَا كَانَ لَكُمْ جَزَٓاءً وَكَانَ سَعْيُكُمْ مَشْكُورًاࣖ ﴿٢٢﴾
اِنَّا نَحْنُ نَزَّلْنَا عَلَيْكَ الْقُرْاٰنَ تَنْزٖيلًاۚ ﴿٢٣﴾ فَاصْبِرْ لِحُكْمِ رَبِّكَ وَلَا تُطِعْ مِنْهُمْ اٰثِمًا اَوْ كَفُورًاۚ ﴿٢٤﴾
وَاذْكُرِ اسْمَ رَبِّكَ بُكْرَةً وَاَصٖيلًاۚ ﴿٢٥﴾ وَمِنَ الَّيْلِ فَاسْجُدْ لَهُ وَسَبِّحْهُ لَيْلًا طَوٖيلًا ﴿٢٦﴾

---

**20) (وَاِذَا رَاَيْتَ ثَمَّ رَاَيْتَ نَعٖيمًا وَمُلْكًا كَبٖيرًا) - (Ey Məhəmməd), o zaman ki, (oruc tutanlardan ötrü) hazırlanan cənnətdə hansı tərəfə baxsan, vəsfə gəlməyən çoxlu nemət və böyük, geniş mülklər görərsən.**

**21) (عَالِيَهُمْ ثِيَابُ سُنْدُسٍ خُضْرٌ وَاِسْتَبْرَقٌۘ) - Onların əyinlərində yaşıl rəngli, incə və qalın ipək libaslar olar, (وَحُلُّوٓا اَسَاوِرَ مِنْ فِضَّةٍۚ) gümüşdən qolbaqlarla bəzənərlər. (وَسَقٰيهُمْ رَبُّهُمْ شَرَابًا طَهُورًا) -** (Ey Məhəmməd), **rəbləri Allah-Təala onlara dünyada oruc tutub, susuz qalmalarının əvəzində hər bir eyibdən pak olan şərab içirər.**

**22) (اِنَّ هٰذَا كَانَ لَكُمْ جَزَٓاءً وَكَانَ سَعْيُكُمْ مَشْكُورًاࣖ) -** (Ey Məhəmməd), **bizim tərəfimizdən onlara xitab olunub deyilər: "O nemətlər ki, sizə verilir, əməllərinizin qarşılığıdır və sizin əməldəki səyiniz bizim yanımızda məqbul və bəyənilmişdir.** (Pak əhli-beyt haqqında nazil olan ayələr burada qurtardı).

**23) (اِنَّا نَحْنُ نَزَّلْنَا عَلَيْكَ الْقُرْاٰنَ تَنْزٖيلًاۚ) -** (Ey Məhəmməd), **həqiqətən, bu Quranı hikmət üzrə müxtəlif vaxtlarda biz özümüz sənə nazil etmişik.**

**24) (فَاصْبِرْ لِحُكْمِ رَبِّكَ وَلَا تُطِعْ مِنْهُمْ اٰثِمًا اَوْ كَفُورًاۚ) -** (Ey Məhəmməd), **insanların əziyyətinə və töhmətinə dözüb, rəbbin Allah-Təalanın hökmündən ötrü səbir edib, peyğəmbərliyi təbliğ edib, düşmənlərinə qalib gəlməyi gözlə, səni günah, ya da küfrə dəvət edənlərə itaət etməyib, fəthi Allah-Təaladan gözlə.**

**25) (وَاذْكُرِ اسْمَ رَبِّكَ بُكْرَةً وَاَصٖيلًاۚ) Hər bir əziyyətə səbir etməkdən əlavə rəbbin Allah-Təalanın adını sübh vaxtı və günortadan sonra zikr edib, onun yeganə zatını pak və müqəddəs say.**

**26) (وَمِنَ الَّيْلِ فَاسْجُدْ لَهُ وَسَبِّحْهُ لَيْلًا طَوٖيلًا) Ey Məhəmməd, gecənin bir qismində Allah-Təalaya səcdə et və gecə boyu Allah-Təalanı pak və müqəddəs sayıb, ona ibadət et.**

اِنَّ هٰٓؤُلَٓاءِ يُحِبُّونَ الْعَاجِلَةَ وَيَذَرُونَ وَرَٓاءَهُمْ يَوْمًا ثَقِيلًا ﴿٢٧﴾ نَحْنُ خَلَقْنَاهُمْ وَشَدَدْنَٓا اَسْرَهُمْۚ وَاِذَا
شِئْنَا بَدَّلْنَٓا اَمْثَالَهُمْ تَبْدِيلًا ﴿٢٨﴾ اِنَّ هٰذِهٖ تَذْكِرَةٌۚ فَمَنْ شَٓاءَ اتَّخَذَ اِلٰى رَبِّهٖ سَبِيلًا ﴿٢٩﴾ وَمَا تَشَٓاؤُ۫نَ
اِلَّٓا اَنْ يَشَٓاءَ اللّٰهُۜ اِنَّ اللّٰهَ كَانَ عَلِيمًا حَكِيمًاۗ ﴿٣٠﴾ يُدْخِلُ مَنْ يَشَٓاءُ فِي رَحْمَتِهٖۜ وَالظَّالِمِينَ اَعَدَّ لَهُمْ
عَذَابًا اَلِيمًا ﴿٣١﴾

---

**27)** (اِنَّ هٰٓؤُلَٓاءِ يُحِبُّونَ الْعَاجِلَةَ وَيَذَرُونَ وَرَٓاءَهُمْ يَوْمًا ثَقِيلًا) - (Ey Məhəmməd), **bu kafirlər ki, sənə itaət etməyib, Qurana iman etmirlər, ancaq dünyanı istəyib, qarşılarındakı şiddətli və dəhşətli qorxunc bir günə** (qiyamət gününə) **hazırlaşmağı tərk edirlər, halbuki əsas olan axirətdir. Gərək hər bir xəbis əməli tərk edib, axirətdən ötrü xeyir əməllər hazırlamaq lazımdır.**

**28)** (نَحْنُ خَلَقْنَاهُمْ وَشَدَدْنَٓا اَسْرَهُمْ) - (Ey Məhəmməd), **insanların hamısını yalnız biz özümüz heç bir kömək olmadan öz qüdrətimizlə yaradıb, onların oynaqlarını damarlar və sinirlər vasitəsi ilə bir-birinə bağlayıb, möhkəm etmişik. Onlar bizi unudub, yaradılışlarını başqa aciz və cansız şeylərə isnad edirlər.** (Necə ki, materialistlər şüur sahibi insanın yaradılmasını şüursuz təbiətə isnad edib, belə bir qəribə məxluqun yaranmasını təsadüfi bir şey sayırlar).

(وَاِذَا شِئْنَا بَدَّلْنَٓا اَمْثَالَهُمْ تَبْدِيلًا) - (Ey Məhəmməd), **əgər biz istəsək, onları həlak edib onların əvəzinə bizə itaət edən onlar kimi** (insanlar), **şəxslər yaradarıq. Lakin hikmətimiz onların əzabını axirətə kimi təxirə salmaqdır.**

**29)** (اِنَّ هٰذِهٖ تَذْكِرَةٌۚ فَمَنْ شَٓاءَ اتَّخَذَ اِلٰى رَبِّهٖ سَبِيلًا) - (Ey Məhəmməd), **həqiqətən, Qurani-Şərifin bu açıq-aydın ayələri insanlardan ötrü öyüd-nəsihətdir. Hər bir şəxs istəsə bu Qurani-Şərifin vasitəsilə öz ixtiyarıyla rəbbi Allah-Təalanın tərəfinə xeyir yolunu tutub, həmişəlik nicata qovuşar.**

**30)** (وَمَا تَشَٓاؤُ۫نَ اِلَّٓا اَنْ يَشَٓاءَ اللّٰهُۜ اِنَّ اللّٰهَ كَانَ عَلِيمًا حَكِيمًاۗ) **Allah-Təala siz asi və kafirləri ancaq zorla məcbur edərək, hidayətə vadar edib, haqq yoluna tabe etmədikcə, siz Allah-Təalanın yoluna tabe olmaq istəməzsiniz, bu da hikmətə zidd olduğu üçün Allah-Təala sizi məcbur etmək istəməyib, iman etməyi sizin öz ixtiyarınıza həvalə etdi. Həqiqətən, Allah-Təala bəndələrinin əhvalına və hər bir əməllərindən agahdır, onları hikmət üzrə yaradıbdır.**

**31)** (يُدْخِلُ مَنْ يَشَٓاءُ فِي رَحْمَتِهٖۜ وَالظَّالِمِينَ اَعَدَّ لَهُمْ عَذَابًا اَلِيمًا) **Allah-Təala kimi istəsə,** (ancaq möminləri) **öz rəhmətinə daxil edər, amma zalımlardan ötrü əziyyət verən əzab hazırlayıbdır.**

Allaha həmd olsun, İnsan surəsinin təfsiri tamamlandı. Pak əhli-beytin fəzilətinə açıq-aşkar işarə edən mübarək bir surədir. Allahın Rəsulu buyurdu: “Kim İnsan surəsini oxusa, Allah-Təala ona cənnət və cənnətdə ipək libaslar bəxş edər.

## əl-MÜRSƏLAT SURƏSİ

77-cu surədir. Məkkədə nazil olub, 50 ayə, 180 kəlmə və 716 hərfdir.

وَالْمُرْسَلَاتِ عُرْفًاۙ ﴿١﴾ فَالْعَاصِفَاتِ عَصْفًاۙ ﴿٢﴾ وَالنَّاشِرَاتِ نَشْرًاۙ ﴿٣﴾ فَالْفَارِقَاتِ فَرْقًاۙ ﴿٤﴾
فَالْمُلْقِيَاتِ ذِكْرًاۙ ﴿٥﴾ عُذْرًا اَوْ نُذْرًاۙ ﴿٦﴾ اِنَّمَا تُوعَدُونَ لَوَاقِعٌؕ ﴿٧﴾ فَاِذَا النُّجُومُ طُمِسَتْۙ ﴿٨﴾
وَاِذَا السَّمَٓاءُ فُرِجَتْۙ ﴿٩﴾ وَاِذَا الْجِبَالُ نُسِفَتْۙ ﴿١٠﴾ وَاِذَا الرُّسُلُ اُقِّتَتْؕ ﴿١١﴾

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (وَالْمُرْسَلَاتِ عُرْفًاۙ) And olsun Qurani-Şərifin ayələrinə ki, dalbadal Məhəmmədin qəlbinə nazil olur.**

**2) (فَالْعَاصِفَاتِ عَصْفًاۙ) Qurani-Şərifin ayələri ilahi əzabı qeyd etməklə xəbis qəlbləri quru otların şiddətli küləklə yerindən qopub, dağılması kimi dağıdıb, pərişan və həqir edəndir.**

**3) (وَالنَّاشِرَاتِ نَشْرًاۙ) - Və and olsun Qurani-Şərifin ayələrinə ki, hidayət və elm, mərifət nurunu insan nəsli arasında yayıb, cəhalətlə ölən qəlbləri elm nuru ilə diriləldər.**

**4) (فَالْفَارِقَاتِ فَرْقًاۙ) Haqqla batil arasına açıq-aşkar fərq qoyandır.**

**5) (فَالْمُلْقِيَاتِ ذِكْرًاۙ) - Öyüd-nəsihəti möminlərin qəlblərinə təlqin edəndir.**

**6) (عُذْرًا اَوْ نُذْرًاۙ) - O ayələr ya tövbə edib, üzrxahlıq edənlərin günahlarının məhv olmasına səbəbdir, ya da ki, qafil olanları Allah-Təalanın əzabı ilə qorxudandır.** (Qurani-Şərifin ayələrinin bir qismi müjdə, digər bir qismi qorxutmağı ehtiva edir).

**7) ( اِنَّمَا تُوعَدُونَ لَوَاقِعٌؕ ) - Bu ayə daha əvvəl qeyd olunan andların cavabıdır.**(Yəni and olsun Quran ayələrinə ki, həqiqətən, sizə rəhmət və əzab, xeyir və şər, nə ki, vəd edilir, hamısı əlbəttə vaqe olacaqdır).

**8) (فَاِذَا النُّجُومُ طُمِسَتْۙ) - O zaman ki, ulduzlar məhv olub nurları sönər,**

**9) (وَاِذَا السَّمَٓاءُ فُرِجَتْۙ) - Və o zaman ki, səma yarılar,** (ruh sahibinə hər bir şeydən yaxın və tənəffüs etməsinə səbəb olan havanın ünsürləri nə zaman ki, bir-birindən aralanıb, öldürücü şəklə girər, o zaman bütün ruh sahibləri həlak olar).

**10) (وَاِذَا الْجِبَالُ نُسِفَتْۙ) - Və o zaman ki, dağlar şiddəti zəlzələdən yerlərindən qoparılıb, ünsürləri parçalanıb dağılar,**

**11) (وَاِذَا الرُّسُلُ اُقِّتَتْ) - Və o zaman ki, peyğəmbərlərin ümmətlərinə**

لِاَيِّ يَوْمٍ اُجِّلَتْۜ ﴿١٢﴾ لِيَوْمِ الْفَصْلِۚ ﴿١٣﴾ وَمَٓا اَدْرٰيكَ مَا يَوْمُ الْفَصْلِۜ ﴿١٤﴾ وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ ﴿١٥﴾ اَلَمْ نُهْلِكِ الْاَوَّلِينَۜ ﴿١٦﴾ ثُمَّ نُتْبِعُهُمُ الْاٰخِرِينَ ﴿١٧﴾ كَذٰلِكَ نَفْعَلُ بِالْمُجْرِمِينَ ﴿١٨﴾ وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ ﴿١٩﴾ اَلَمْ نَخْلُقْكُمْ مِنْ مَٓاءٍ مَهِينٍۙ ﴿٢٠﴾ فَجَعَلْنَاهُ فٖي قَرَارٍ مَكٖينٍۙ ﴿٢١﴾ اِلٰى قَدَرٍ مَعْلُومٍۙ ﴿٢٢﴾

---

**şəhadət etməkdən ötrü təyin olunmuş vaxtları bəyan edilib, bütün peyğəmbərlərin hazır olduğu anda Allah-Təalanın rəhmət və əzab günü (qiyamət günü) vaqe olar.**

**12) (لِاَيِّ يَوْمٍ اُجِّلَتْۜ)** - (Ey Məhəmməd), **bu məxluqata hansı dəhşətli və qorxunc gündən ötrü möhlət verilib, təxirə salınıblar? Sən o günə agah deyilsən.**

**13) (لِيَوْمِ الْفَصْلِۚ) - Onların təxirə salınması insanlar arasında haqq və ədalətlə hökm olunan gündən ötrüdür.**

**14) (وَمَٓا اَدْرٰيكَ مَا يَوْمُ الْفَصْلِ)** (Ey Məhəmməd), **haqq və ədalətlə hökm olunan günün dəhşət və şiddətini sənə nə bildirib? Heç bir şey sənə bildirilməyib və onun şiddətli dəhşətinə agah deyilsən.**

**15) (وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ) - Ogünkü gündə** (qiyamət günündə) **tövhid və axirəti təkzib edənlərə əzab və fəlakət olsun.** (Yəni Allah-Təalanın əzabı onları tutub, əbədiyyən əzabda olacaqlar).

**16-17) ( اَلَمْ نُهْلِكِ الْاَوَّلِينَۜ ثُمَّ نُتْبِعُهُمُ الْاٰخِرِينَ ) - (Ey Məhəmməd), haqqı inkar edənlərə xəbər ver ki, bəs baxıb görmürlər ki, onlardan əvvəl haqqı inkar edənlərə dünyada əzab göndərib, həlak etmişik. Ondan sonra başqalarını yaradıb, yer üzündə məskun etmişik. Onları da küfr və zəlalətlərinə görə həlak etməyə qadirik.** (Ey Məhəmməd, səni təkzib edən müşrikləri də həlak etməyə qadirik).

**18) (كَذٰلِكَ نَفْعَلُ بِالْمُجْرِمِينَ)** - (Ey Məhəmməd), **asi və günahkarlara belə əzab edərik.**

**19) (وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ) Qiyamət günündə tövhid və axirəti təkzib edənlərə əzab və fəlakət olsun!**

**20) (اَلَمْ نَخْلُقْكُمْ مِنْ مَٓاءٍ مَهِينٍۙ) ey Adəm övladı, bəs sizi qoxan, bir damcı sudan** (spermadan) **yaratmamışıqmı? Bununla belə necə mənə kafir olub şərik qoşursunuz?**

**21-22) (فَجَعَلْنَاهُ فٖي قَرَارٍ مَكٖينٍۙ اِلٰى قَدَرٍ مَعْلُومٍۙ) - O spermanı müəyyən bir vaxta kimi** (doğuş vaxtına kimi) **bir yerdə** (ananın bətnində) **yerləşdirdik.** (Elə ki,

فَقَدَرْنَاۗ فَنِعْمَ الْقَادِرُونَ ﴿٢٣﴾ وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ ﴿٢٤﴾ اَلَمْ نَجْعَلِ الْاَرْضَ كِفَاتًاۙ ﴿٢٥﴾ اَحْيَاۤءً
وَاَمْوَاتًاۙ ﴿٢٦﴾ وَجَعَلْنَا فِيهَا رَوَاسِيَ شَامِخَاتٍ وَاَسْقَيْنَاكُمْ مَاۤءً فُرَاتًاۜ ﴿٢٧﴾ وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ ﴿٢٨﴾
اِنْطَلِقُوۤا اِلٰى مَا كُنْتُمْ بِهِ تُكَذِّبُونَۚ ﴿٢٩﴾ اِنْطَلِقُوۤا اِلٰى ظِلٍّ ذِي ثَلٰثِ شُعَبٍۙ ﴿٣٠﴾ لَا ظَلِيلٍ وَلَا يُغْنِي مِنَ
اللَّهَبِۜ ﴿٣١﴾ اِنَّهَا تَرْمِي بِشَرَرٍ كَالْقَصْرِۚ ﴿٣٢﴾ كَاَنَّهُ جِمَالَتٌ صُفْرٌۜ ﴿٣٣﴾ وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ ﴿٣٤﴾

---

doğuş vaxtı gəldi, öz kamil qüdrətimizlə onu gözəl bir insan surətində oradan çıxararıq).

**23)** (فَقَدَرْنَاۗ فَنِعْمَ الْقَادِرُونَ) - (Ey Məhəmməd), **insanın doğuluşunu biz belə təqdir etdik. Nə gözəl təqdir edənik ki, az bir zamanda spermadan insan yaradıb, ananın bətnindən dünya aləminə çıxartdıq.**

**24)** (وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ) **Qiyamət günündə tövhid və axirəti təkzib edənlərə əzab və fəlakət olsun!** (Tövhidi və ilahi qüdrəti təkzib edənlərə mütləq əzab ediləcəyindən bu ayə təkrar olundu).

**25-26)** (اَلَمْ نَجْعَلِ الْاَرْضَ كِفَاتًاۙ اَحْيَاۤءً وَاَمْوَاتًاۙ) **Ey Adəm övladı, bəs biz bu yeri üstündə saysız-hesabsız diriləri, bətnində ölüləri toplayıb daşıyan etmədikmi? Ta ki, sizin həm diriləriniz, həm də ölülərinizdən ötrü qərargah olsun.**

**27)** (وَجَعَلْنَا فِيهَا رَوَاسِيَ شَامِخَاتٍ وَاَسْقَيْنَاكُمْ مَاۤءً فُرَاتًاۜ ) **Yerdə uca və möhkəm dağlar yaratdıq, o dağların səbəbinə sizə dadlı sular içirdirik.**

**28)** (وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ) **Qiyamət günündə tövhid və axirəti təkzib edənlərə əzab və fəlakət olsun!**

**29)** (اِنْطَلِقُوۤا اِلٰى مَا كُنْتُمْ بِهِ تُكَذِّبُونَۚ) **Qiyamət günündə kafir və müşriklərə deyilər: "Dünyada təkzib etdiyiniz cəhənnəm əzabına tərəf gedin!**

**30)** (اِنْطَلِقُوۤا اِلٰى ظِلٍّ ذِي ثَلٰثِ شُعَبٍۙ) **- Cəhənnəmdən çıxan üç hissəli** (duman) **tüstünün kölgəsinə tərəf gedin. Görək orada sizdən ötrü necə əzablar hazırlanıbdır?**

**31)** (لَا ظَلِيلٍ وَلَا يُغْنِي مِنَ اللَّهَبِۜ) **- O kölgə siz müşrikləri** (möminləri qoruduğu kimi) **nə istidən qoruyar və nə də cəhənnəm alovunu sizdən dəf edər.**

**32-33)** (اِنَّهَا تَرْمِي بِشَرَرٍ كَالْقَصْرِۚ كَاَنَّهُ جِمَالَتٌ صُفْرٌۜ) **- Cəhənnəm uca qəsrlər boyda alovdan qığılcımlar saçar, qığılcımın hər biri sanki sarı rəngli uca dəvə kimidir.** (Ərəblərin anlaması üçün cəhənnəm alovunun qığılcımları qəsrlərə və dəvələrə bənzədilir).

**34)** (وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ) **Qiyamət günündə tövhid və axirəti təkzib edənlərə əzab və fəlakət olsun!**

هٰذَا يَوْمُ لَا يَنْطِقُونَۙ ﴿٣٥﴾ وَلَا يُؤْذَنُ لَهُمْ فَيَعْتَذِرُونَ ﴿٣٦﴾ وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ ﴿٣٧﴾ هٰذَا
يَوْمُ الْفَصْلِۚ جَمَعْنَاكُمْ وَالْاَوَّلِينَ ﴿٣٨﴾ فَاِنْ كَانَ لَكُمْ كَيْدٌ فَكِيدُونِ ﴿٣٩﴾ وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ
﴿٤٠﴾ۘ اِنَّ الْمُتَّقِينَ فِي ظِلَالٍ وَعُيُونٍۙ ﴿٤١﴾ وَفَوَاكِهَ مِمَّا يَشْتَهُونَؕ ﴿٤٢﴾ كُلُوا وَاشْرَبُوا هَنِيئًا بِمَا
كُنْتُمْ تَعْمَلُونَ ﴿٤٣﴾ اِنَّا كَذٰلِكَ نَجْزِي الْمُحْسِنِينَ ﴿٤٤﴾ وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ ﴿٤٥﴾

---

**35) (هٰذَا يَوْمُ لَا يَنْطِقُونَۙ)** - (Ey Məhəmməd), **o gün ki, onun əhvalatını sənə bəyan etdik, o elə bir gündür ki, o gündə asi və müşriklər dəlil və sübut gətirib, danışmağa qadir olmazlar.** (Qiyamət gününün vaxtları müxtəlif olar, bəzən asilərə danışmağa izin verilib, bəzən izin verilməz).

**36) (وَلَا يُؤْذَنُ لَهُمْ فَيَعْتَذِرُونَ) - Onlara zidd əməllərinə görə üzrxahlıq etmələri üçün izin verilməz.**

**37) (وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ) Qiyamət günündə tövhid və axirəti təkzib edənlərə əzab və fəlakət olsun!**

**38) (هٰذَا يَوْمُ الْفَصْلِۚ جَمَعْنَاكُمْ وَالْاَوَّلِينَ) Qiyamət günündə siz asi və kafirlərə deyilər: "Haqq və batilin, xoşbəxt və bədbəxt asinin bir-birindən aralandığı gün bu gündür. Sizi və sizdən əvvəlkiləri bu gün tamamilə bir yerə toplamışıq.**

**39) (فَاِنْ كَانَ لَكُمْ كَيْدٌ فَكِيدُونِ) - Dünyada Allah-Təalanın sözünə və peyğəmbərinə qarşı məkr və hiylələr qurdunuz. Əgər bu günkü gündə də bir hiyləniz varsa, mənə qarşı o hiyləni edin ki, əzabımdan xilas olasınız.**

**40) (وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ) Qiyamət günündə tövhid və axirəti təkzib edənlərə əzab və fəlakət olsun!**

**41) (اِنَّ الْمُتَّقِينَ فِي ظِلَالٍ وَعُيُونٍۙ)** - (Ey Məhəmməd), **həqiqətən, müttəqilər axirətdə kölgələrdə rahat olub, çeşmələrdən dadlı su içirlər.**

**42) (وَفَوَاكِهَ مِمَّا يَشْتَهُونَؕ) Ləziz və istədikləri meyvələr onlardan ötrü hazır edilər.**

**43) (كُلُوا وَاشْرَبُوا هَنِيئًا بِمَا كُنْتُمْ تَعْمَلُونَ) - Müttəqilərə bizim tərəfimizdən deyilər: "Dünyada etdiyiniz xeyir əməllər səbəbinə indi bu dadlı nemətlərdən və bu sulardan yeyib-içib, rahatlanın.**

**44) (اِنَّا كَذٰلِكَ نَجْزِي الْمُحْسِنِينَ)** - (Ey Məhəmməd), **həqiqətən, biz yaxşı əməl sahiblərinə belə mükafat verərik.**

**45) (وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ) Qiyamət günündə tövhid və axirəti təkzib edənlərə əzab və fəlakət olsun!**

كُلُوا وَتَمَتَّعُوا قَلِيلًا اِنَّكُمْ مُجْرِمُونَ ﴿٤٦﴾ وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ ﴿٤٧﴾ وَاِذَا قِيلَ لَهُمُ ارْكَعُوا لَا
يَرْكَعُونَ ﴿٤٨﴾ وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ ﴿٤٩﴾ فَبِاَيِّ حَدِيثٍ بَعْدَهُ يُؤْمِنُونَ ﴿٥٠﴾

---

**46) (كُلُوا وَتَمَتَّعُوا قَلِيلًا اِنَّكُمْ مُجْرِمُونَ) Ey müşriklər və asilər, dünyada az bir zaman yeyib-içib, ləzzət alın. Lakin həqiqətən, siz günahkarsınız. Əlbəttə, günahkarlar cəzalarına çatacaqdır.**

**47) (وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ) Qiyamət günündə tövhid və axirəti təkzib edənlərə əzab və fəlakət olsun!**

**48) (وَاِذَا قِيلَ لَهُمُ ارْكَعُوا لَا يَرْكَعُونَ) - O zaman ki, asilərə və müşriklərə deyilər: "Gəlin Allah-Təalaya qarşı təvazö edib, müvəhhid olub, onun dinini qəbul edib, təkəbbür etməyin, onlar qəbul etməyib, təkəbbürlülüyü tərk etməzlər və bu səbəbdən əzaba layiq olarlar.**

**49) (وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبِينَ) Qiyamət günündə tövhid və axirəti təkzib edənlərə əzab və fəlakət olsun!**

**50) (فَبِاَيِّ حَدِيثٍ بَعْدَهُ يُؤْمِنُونَ)** - (Ey Məhəmməd), **bəs müşriklər Qurani-Şərif kimi bir kitabın sözlərinə iman etməyəndən sonra hansı sözə iman edəcəklər? Belə məlum olur ki, müşriklər haqq sözə iman edən deyildir.**

Allaha həmd olsun, əl-Mursəlat surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: "Kim əl-Mursəlat surəsini oxusa, Allah-Təala tərəfindən onun müşriklərdən olmaması qeyd olunar.

## AMMƏ (ən-NƏBƏ) SURƏSİ

78-ci surədir. Məkkədə nazil olub, 42 ayə, 173 kəlmə və 970 hərfdir.

عَمَّ يَتَسَآءَلُونَ ﴿١﴾ عَنِ النَّبَإِ الْعَظِيمِ ﴿٢﴾ اَلَّذِي هُمْ فِيهِ مُخْتَلِفُونَ ﴿٣﴾ كَلَّا سَيَعْلَمُونَ ﴿٤﴾ ثُمَّ
كَلَّا سَيَعْلَمُونَ ﴿٥﴾ اَلَمْ نَجْعَلِ الْاَرْضَ مِهَادًا ﴿٦﴾ وَالْجِبَالَ اَوْتَادًا ﴿٧﴾ وَخَلَقْنَاكُمْ اَزْوَاجًا ﴿٨﴾
وَجَعَلْنَا نَوْمَكُمْ سُبَاتًا ﴿٩﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1-3) (عَمَّ يَتَسَآءَلُونَ عَنِ النَّبَإِ الْعَظِيمِ)** - (Ey Məhəmməd), **bəs müşriklər bir-birlərindən nə soruşurlar? O böyük xəbər** (Quran) **haqqında bir-birlərindən soruşurlar: "Bu nə kəlamdır ki,** (Məhəmməd) **gətiribdir".** (Məkkə əhli bir-birləri ilə danışıb, Quran haqqında ixtilaf edib, onu inkar edirdilər, o barədə bu surə nazil oldu). **(اَلَّذِي هُمْ فِيهِ مُخْتَلِفُونَ) - O böyük xəbər** (Quran) **haqqında müşriklər ixtilaf edib, hərəsi bir söz deyir.**

**4) (كَلَّا سَيَعْلَمُونَ) Yox, gərək Quran haqqında ixtilaf etməyib, təkzib etməsinlər. Əlbəttə, təkzib etməyin aqibətinə və Quranın haqq olmasına agah olacaqlar. O vaxt da onlara heç bir fayda verməyib, bizim əzabımız onları tutacaqdır.**

**5) (ثُمَّ كَلَّا سَيَعْلَمُونَ) Yenə deyirəm, əlbəttə, gərək Quran haqqında ixtilaf etməyib, təkzib etməsinlər. Təkzib etməyin aqibətinə və Quranın haqq olmasına agah olacaqlar.** (Bu ayə təkzib və ixtilafı tərk etməyi təkrar bildirmək üçün təkrarlandı).

**6) (اَلَمْ نَجْعَلِ الْاَرْضَ مِهَادًا) Quranı inkar etmək bizim tövhid və qüdrətimizi inkar etməkdir, halbuki bizim tövhid və qüdrətimizin dəlil və sübutları sizdən ötrü məlum və aydındır. Bəs sizin orada məskun olmağınız üçün yeri sizdən ötrü mənzil və məskən etmədikmi? Belə etdik ki, yerdə rahat olub, hər bir işinizi asanlıqla görəsiniz.**

**7) (وَالْجِبَالَ اَوْتَادًا) - Bəs dağları yerdən ötrü mismar etmədikmi? Hansı ki, onların səbəbinə fayda əldə edirsiniz.**

**8) (وَخَلَقْنَاكُمْ اَزْوَاجًا) - Və öz kamil qüdrəti ilə siz insanları iki cins** (kişi və qadın) **yaratdıq ki, nəslinizi artırıb, yer üzündə yayılasınız.**

**9) (وَجَعَلْنَا نَوْمَكُمْ سُبَاتًا) Yuxunu sizə hakim etdik, yuxu səbəbinə hər bir əməldən uzaqlaşırsınız, yuxunu bədəninizdən ötrü rahatlıq səbəbi etdik.**

وَجَعَلْنَا الَّيْلَ لِبَاسًاۙ ﴿١٠﴾ وَجَعَلْنَا النَّهَارَ مَعَاشًاۖ ﴿١١﴾ وَبَنَيْنَا فَوْقَكُمْ سَبْعًا شِدَادًاۙ ﴿١٢﴾ وَجَعَلْنَا
سِرَاجًا وَهَّاجًاۖ ﴿١٣﴾ وَاَنْزَلْنَا مِنَ الْمُعْصِرَاتِ مَٓاءً ثَجَّاجًاۙ ﴿١٤﴾ لِنُخْرِجَ بِهٖ حَبًّا وَنَبَاتًاۙ﴿١٥﴾
وَجَنَّاتٍ اَلْفَافًاۜ﴿١٦﴾ اِنَّ يَوْمَ الْفَصْلِ كَانَ مٖيقَاتًاۙ﴿١٧﴾ يَوْمَ يُنْفَخُ فِي الصُّورِ فَتَأْتُونَ اَفْوَاجًاۙ﴿١٨﴾

---

**10) (وَجَعَلْنَا الَّيْلَ لِبَاسًاۙ) - Və gecəni sizdən ötrü libas etdik. Libas bədəni örtən kimi gecə də etdiyiniz məxfi əməlləri örtür.**

**11) (وَجَعَلْنَا النَّهَارَ مَعَاشًاۖ) - Və gündüzü sizdən ötrü məişət** (dolanışıq) **zamanı etdik ki, hər bir ehtiyacınızla, iş və qazancınızla məşğul olub, gündüzün işığında xəyanət və hiylədən əmin-amanda olasınız.**

**12) (وَبَنَيْنَا فَوْقَكُمْ سَبْعًا شِدَادًاۙ) - Və sizin üstünüzdə hər bir ruh sahibinin həyatına, inkişafına və ruzisinin bərəkətli olmasına səbəb olan yeddi təbəqəli möhkəm və qüvvətli səmanı** (havanı) **yaratdıq.**

**13) (وَجَعَلْنَا سِرَاجًا وَهَّاجًاۖ) - Və sizdən ötrü doğan günəşi şiddətlə yanan çıraq etdik.**

**14) (وَاَنْزَلْنَا مِنَ الْمُعْصِرَاتِ مَٓاءً ثَجَّاجًاۙ) Küləklərin sıxdığı buludlardan sizdən ötrü yer üzünə çoxlu su endirdik.**

**15-16) (لِنُخْرِجَ بِهٖ حَبًّا وَنَبَاتًاۙ وَجَنَّاتٍ اَلْفَافًاۜ) - Belə ki, o suyun səbəbinə dən, bitki və ağacları bir-birinə sarmaşan bağları sizdən ötrü yetişdirək və siz onlardan faydalanasınız. Bunların hamısını öz kamil qüdrətimizlə sizdən ötrü yaratmışıq. Bəs bunlara diqqətlə baxıb, təfəkkür edib, bizim tövhid və qüdrətimizə inanmazsınızmı?**

**17) ( اِنَّ يَوْمَ الْفَصْلِ كَانَ مٖيقَاتًاۙ) - Bu dünyadan ötrü müəyyən bir gün** (ömür) **vardır. Həqiqətən, qiyamət günü Allah-Təalanın hikmət və təqdiri ilə dünyanın sonudur.** (O vaxt yer kürəsinin ünsürləri bir-birindən qopub, dağılıb, başqa bir surətə daxil olub, dünyanın ömrü də sona çatar).

**18) (يَوْمَ يُنْفَخُ فِي الصُّورِ فَتَأْتُونَ اَفْوَاجًاۙ) - O gün ki,** (qiyamət günü) **surətlərə ruh üflənər, siz insan nəsli müxtəlif* dəstələrlə, hər dəstə öz imam və rəhbəri ilə məhşərə, Allah-Təalanın hüzuruna varid olarsınız.**

**(*Qeyd:** *"Muaz ibn Cəbəl insanların müxtəlif dəstələrlə məhşərə necə varid olacağı haqqında Allahın Rəsuluna sual verdi. Peyğəmbər (ə.s) buyurdu: "Ey Muaz, böyük bir sual verdin. Ondan sonra gözlərindən yaş axdı və buyurdu: "Mənim ümmətimdən olan asilər 10 qrup halında məhşərə varid olarlar. 1) meymun surətində olanlar, 2) donuz surətində olanlar, 3) ayaqları boyunlarına bağlanıb, üzü üstə olanlar, 4) kor, 5) kar və lal olanlar, 6) dillərini çeynədikləri halda, dilləri sinələrinə sallanıb, ağızlarından çirk axanlar, digər məhşər əhli onlardan iyrənib, əziyyətə məruz qalarlar, 7) əlləri və ayaqları kəsilənlər, 8)*

وَفُتِحَتِ السَّمَآءُ فَكَانَتْ اَبْوَابًاۙ ﴿١٩﴾ وَسُيِّرَتِ الْجِبَالُ فَكَانَتْ سَرَابًاؕ ﴿٢٠﴾ اِنَّ جَهَنَّمَ كَانَتْ مِرْصَادًاۙ ﴿٢١﴾ لِلطَّاغِينَ مَاٰبًاۙ ﴿٢٢﴾ لَابِثِينَ فِيهَآ اَحْقَابًاۚ ﴿٢٣﴾

---

*oddan dar ağacına asılanlar, 9) bədənləri ölü heyvanın bədənindən daha çox qoxmuş olanlar, 10) qatrandan libas geyinib bədənlərinə yapışıb yanan, amma meymun surətində olanlar. Bunlar camaatın arasında söz gəzdirib bundan ona, ondan buna söz deyib, ara qarışdıran meymun kimi hiyləbaz şəxslərdir. Donuz surətində olanlar camaatın malını haram yolla ələ keçirib, yeyənlərdir. Üzü üstə sürünənlər faiz yeyənlərdir. Korlar vəzifə sahibi olub tərəfkeşlik edən, hökm verərkən zülm edənlərdir. Kar və lal olanlar öz nanəcib əməllərini bəyənənlərdir. Dillərini çeynəyənlər sözləri ilə əməlləri bir-birinə zidd olan, insanlara xeyri əmr edib, özləri şər əməl sahibi olan alimlərdir. Əl və ayağı kəsilənlər qonşuları ilə pis rəftar edib, onlara əziyyət edənlərdir. Oddan dar ağacına asılanlar səbəbsiz yerə insanlara şər atıb, hökumətə çuğullayıb, həbsə və əzaba düçar edənlərdirlər. Bədənləri ölü heyvanın bədənindən çox qoxanlar nəfsani arzulara tabe olub, xəbis əməllərə qurşanıb, mallarından Allah-Təalanın əmr etdiyi vacib bir haqqı (zəkatı) verməyənlərdir. Qatrandan libas geyinənlər öz yoldaşlarına və qohum-əqrəbalarına qarşı təkəbbürlü olub, özləri ilə iftixar edənlərdir. Ağıl sahiblərinə bu hədisə diqqətlə baxıb, təfəkkür etməyi tövsiyə edirəm ki, bizim uca peyğəmbərimizin xəbis və murdar əməllərə qurşananların həqiqi şeytani sifətlərini necə sadə misalla bizdən ötrü bəyan edib və bizə belə əməlləri qadağan etməsindən ibrət alsınlar. Bununla belə biz müsəlmanlar belə ibrətamiz sözlərə qulaq asmayıb, ibrət almadığımız halda, adımızı müsəlman qoyub, özümüzü o cənabın ümməti saymamız böyük xətadır, zahirən və mənən insan olmaq lazımdır, ey müsəlmanlar, gəlin hidayətə, doğru yola, cəhaləti tərk edib, möhkəm qulp olan Quran elmindən yapışıb, özünüzü cəhalətin alovundan xilas edin).*

**19) (وَفُتِحَتِ السَّمَآءُ فَكَانَتْ اَبْوَابًاۙ) Göy** (Bizi əhatə edən hava) **yarılıb, dünya məhv olduğu üçün (başqa bir aləmə) qapılar və yollar açılar.** (Əlbəttə bu aləm dəyişəndən sonra başqa bir aləm meydana çıxacaqdır).

**20) (وَسُيِّرَتِ الْجِبَالُ فَكَانَتْ سَرَابًاؕ) Şiddəti zəlzələdən dağlar yerindən qoparılıb, ilğım kimi bir şey olub, məhv və yox olarlar.**

**21) (اِنَّ جَهَنَّمَ كَانَتْ مِرْصَادًاۙ) Həqiqətən, cəhənnəm asilərdən ötrü intizar çəkilən məqamdır. Orada onların intizarı çəkilər.**

**22) (لِلطَّاغِينَ مَاٰبًاۙ) Asi və azğınlardan ötrü cəhənnəm qayıdılacaq bir yer olub, son məskənləri cəhənnəm olacaqdır.**

**23) (لَابِثِينَ فِيهَآ اَحْقَابًاۚ) - Cəhənnəmdə uzun bir zaman, sonu gəlməyən illərlə əzab içində qalacaqlar.**

لَا يَذُوقُونَ فِيهَا بَرْدًا وَلَا شَرَابًاۙ ﴿٢٤﴾ اِلَّا حَمِيمًا وَغَسَّاقًاۙ ﴿٢٥﴾ جَزَٓاءً وِفَاقًا ﴿٢٦﴾ اِنَّهُمْ كَانُوا
لَا يَرْجُونَ حِسَابًاۙ ﴿٢٧﴾ وَكَذَّبُوا بِاٰيَاتِنَا كِذَّابًاۜ ﴿٢٨﴾ وَكُلَّ شَيْءٍ اَحْصَيْنَاهُ كِتَابًا﴿٢٩﴾ فَذُوقُوا فَلَنْ
نَزِيدَكُمْ اِلَّا عَذَابًا﴿٣٠﴾ اِنَّ لِلْمُتَّقِينَ مَفَازًاۙ ﴿٣١﴾ حَدَٓائِقَ وَاَعْنَابًاۙ ﴿٣٢﴾ وَكَوَاعِبَ اَتْرَابًاۙ ﴿٣٣﴾
وَكَاْسًا دِهَاقًاۜ ﴿٣٤﴾

---

**24-25) (لَا يَذُوقُونَ فِيهَا بَرْدًا وَلَا شَرَابًاۙ اِلَّا حَمِيمًا وَغَسَّاقًاۙ) - Cəhənnəmdə özləri üçün nə bir sərinlik və nə də hərarətlərini sakitləşdirən içilən bir şeydən dadmazlar, ancaq ciyərlərini parçalayan isti su və cəhənnəm əhlinin bədənlərindən axan çirkli irinlərdən onlara içirərlər.**

**26) (جَزَٓاءً وِفَاقًا) - Onlara əməllərinə müvafiq cəza verilib, zülmə məruz qalmazlar.**

**27) (اِنَّهُمْ كَانُوا لَا يَرْجُونَ حِسَابًاۙ)** - (Ey Məhəmməd), **həqiqətən, asi və azğınlar axirətdə onlarla haqq-hesab olunub, əməllərinin cəzasına çatmağa ümidvar olmayıb, qiyaməti inkar edirdilər.**

**28) (وَكَذَّبُوا بِاٰيَاتِنَا كِذَّابًاۜ) - Bizim ayələrimizi də müşriklər elə hey təkzib etdilər və bu səbəbdən axirətdə əzabımız onlara şamil olacaqdır.**

**29) (وَكُلَّ شَيْءٍ اَحْصَيْنَاهُ كِتَابًا)** - (Ey Məhəmməd), **hər bir şey bizim elmimizdə sabit olduğu halda bütün hamısının sayını və xüsusiyyətini qeyd edib hesabını qorumuşuq.**

**30) (فَذُوقُوا فَلَنْ نَزِيدَكُمْ اِلَّا عَذَابًا) - Müşrik və asilər qiyamət günündə əzaba yaxalanıb, onlara deyilər: "Bu əzabı dadın və xatircəm olun ki, sizdən ötrü əbədiyyən əzabdan başqa bir şey artırmayacağıq. Bağışlanmaqdan ümidinizi kəsib, həmişə əzabda olacağınıza inanın.** (Asi və müşriklərin halını bəyan edəndən sonra növbəti ayədə müttəqilərin halını bəyan etməyə başlayır).

**31) (اِنَّ لِلْمُتَّقِينَ مَفَازًاۙ) Həqiqətən, axirətdə müttəqilərdən ötrü ürəkləri istəyən şeyə qovuşub, asilərin əzabından nicat tapmaq vardır.**

**32) (حَدَٓائِقَ وَاَعْنَابًاۙ) - Müttəqilərin qovuşduğu şeylər bunlardır. Hər bir növ meyvə bağları və xüsusi olaraq üzümlər onlardan ötrü hazırdır.**

**33) (وَكَوَاعِبَ اَتْرَابًاۙ) Habelə onlardan ötrü hamısı eyni yaşda olan, sinələri qabarmış gözəl qızlar vardır.** (Şəhvət düşkünü olanlara müjdə olsun!)

**34) (وَكَاْسًا دِهَاقًاۜ) - Və yenə xidmətçilərin əllərində müxtəlif şərablarla dopdolu* büllur qədəhlər onlardan ötrü hazırdır.**

لَا يَسْمَعُونَ فِيهَا لَغْوًا وَلَا كِذَّابًاۚ ﴿٣٥﴾ جَزَٓاءً مِنْ رَبِّكَ عَطَاءً حِسَابًاۙ﴿٣٦﴾ رَبِّ السَّمٰوَاتِ وَالْاَرْضِ
وَمَا بَيْنَهُمَا الرَّحْمٰنِ لَا يَمْلِكُونَ مِنْهُ خِطَابًاۚ ﴿٣٧﴾ يَوْمَ يَقُومُ الرُّوحُ وَالْمَلٰٓئِكَةُ صَفًّاۜ لَا يَتَكَلَّمُونَ اِلَّا
مَنْ اَذِنَ لَهُ الرَّحْمٰنُ وَقَالَ صَوَابًا ﴿٣٨﴾

---

**(*Qeyd:** *"Əsmai deyir: "Ayədəki "kasən dihaqə"nin mənasına tam agah deyildim. Bir vaxt bir işdən ötrü kəndə gedib, Bəsrəli ərəblərin məclisinə daxil oldum, o məclisdə bir müğənni qız var idi. Elə ki, mahnını oxuyub qurtardı, üzünü qulama tutub dedi: "Ya qulam ə`tini kasən dihaqən", mən gözlədim ki, görək qulam bu sözdən nə anlyacaq? Bir də gördüm ki, qulam dopdolu bir qədəh gətirib müğənni qıza verdi. O vaxt mən agah oldum ki, ayənin mənası "dopdolu qədəh" mənasınadır və o qızın bu sözdən məqsədi də "mənə dopdolu bir qədəh gətir" deməк imiş. Bəli, Quran ərəb dilində olduğu üçün, gərək Quranın mənasını da ərəb dilində işləndiyi kimi anlayaq, Qurani-Şərifdəki qəliz kəlmələri gərək ərəblər necə anlayırsa, biz də gərək onlara tabe olub, elə məna verək. Bu əmr təkcə Qurana məxsus olmayıb, hər bir kitabın mənası hansı xalqın dildə isə, o xalqın işlətdiyi şəkildə o sözə məna verməк lazımdır. Əgər başqa bir məna verilsə, istilahdan kənar olub, kitab sahibinin məqsədi boşa çıxar. Habelə Qurani-Şərif ərəb istilahları və adət-ənənəsi ilə nazil olduğu üçün Allah-Təalanın məqsədi də həmin ərəb istilahıyla nəzərdə tutulan mənadır. Ona başqa, uzaq mənalar yükləmək şəriət sahibinin məqsədini anlamayıb, əsl istilah mənasından uzaqlaşmaqdır. Qurani-Şərif isə bizim üçün ən vacib elm və əməl kitabıdır. O adamlar ki, Quran elmini - biz anlaya bilmərik, ancaq imamlar, ya da səhabələr anlaya bilər deyib, bu elmi onlara həvalə edirlər, onlar islam dininin haqlılığını dəlilsiz və şüursuz şəkildə qəbul edib, ona dəlilsiz-sübutsuz şəkildə inanmış olurlar. Qurani-Şərif isə qəliz və müəmmalı, istifadəsi mümkün olmayan bir kitab deyildir. Qeyb olmaqdan, doğru yoldan azmaqdan Allaha sığınıram").*

**35) (لَا يَسْمَعُونَ فِيهَا لَغْوًا وَلَا كِذَّابًاۚ) - Müttəqilər cənnətdə nə mənasız, boş bir söz, nə də bir-birinin sözünü təkzib etməyi eşitməzlər. Əksinə, hər bir vaxt haqq söz danışıb, bir-birlərini təsdiq edərlər.**

**36) (جَزَٓاءً مِنْ رَبِّكَ عَطَاءً حِسَابًاۙ)** - (Ey Məhəmməd), **Allah-Təala tərəfindən müttəqilərə verən nemətlər öz əməllərinin mükafatıdır. Sənin rəbbin Allah-Təaladan kifayət edən qədər onlara bəxş olunar.**

**37) (رَبِّ السَّمٰوَاتِ وَالْاَرْضِ وَمَا بَيْنَهُمَا الرَّحْمٰنِ لَا يَمْلِكُونَ مِنْهُ خِطَابًاۚ) Göylərin və yerin və onların arasında olan məxluqatın tərbiyə verən rəbbi Rəhman olan Allah-Təaladır. Göylərin və yerin məxluqatı heç bir işdə Allah-Təalaya xitab edib, etiraz etməyə qadir deyildirlər. Bütün şeylərin maliki və hər bir işi idarə etmək ixtiyarı yeganə olan Allaha məxsusdur.**

**38) (يَوْمَ يَقُومُ الرُّوحُ وَالْمَلٰٓئِكَةُ صَفًّاۜ لَا يَتَكَلَّمُونَ اِلَّا مَنْ اَذِنَ لَهُ الرَّحْمٰنُ وَقَالَ صَوَابًا) - O gün**

ذٰلِكَ الْيَوْمُ الْحَقُّ ۚ فَمَنْ شَآءَ اتَّخَذَ اِلٰى رَبِّهٖ مَاٰبًا ﴿٣٩﴾ اِنَّٓا اَنْذَرْنَاكُمْ عَذَابًا قَرِيبًاۚ يَوْمَ يَنْظُرُ الْمَرْءُ مَا
قَدَّمَتْ يَدَاهُ وَيَقُولُ الْكَافِرُ يَا لَيْتَنِي كُنْتُ تُرَابًا ﴿٤٠﴾

---

**ki,** (qiyamət günü)* **ruh və mələklər aləmlərin rəbbinin hüzurunda səf-səf durarlar, elə bir gündə məhşər əhli danışmağa qadir olmaz. Ancaq o şəxs ki, Allah-Təala onunla danışıb, şəfaət etməyə izin verir və danışanda da haqq sözlər deyir, belə şəxsdən başqa heç bir şəxs danışmağa qadir olmaz.**

**(*Qeyd:** *"Mələklər mücərrəd ruh sahibi olduğu içün ruhdan məqsəd ya həmin mələklərdir, ya da ki, məqsəd Allah-Təalanın Adəmi yaradarkən, "ona ruhumdan üflədim" ayəsində dediyi kimi öz müqəddəs zatına isnad etdiyi ruhdur. Təfəkkür etmək lazımdır. Müdrikə bir işarə də kafidir).*

**39) (ذٰلِكَ الْيَوْمُ الْحَقُّ ۚ فَمَنْ شَآءَ اتَّخَذَ اِلٰى رَبِّهٖ مَاٰبًا) - Bu qiyamət günü haqq olan gündür, əlbəttə vaqe olacaqdır. Kim ki, qiyamət günündə rəbbi Allah-Təala tərəfinə dönərkən əzabdan amanda olmaq istəyirsə, itaət edərək Allah-Təalanın tərəfinə yol tutar.**

**40) (اِنَّٓا اَنْذَرْنَاكُمْ عَذَابًا قَرِيبًاۚ) Ey kafir və asilər, həqiqətən, öldükdən sonra sizi yaxın olan bir əzabla qorxuduruq, lakin siz itaət etməyib, qəbul etmirsiniz. Belə olan halda daha sizdən ötrü qiyamət günündə heç bir üzrxahlıq mümkün deyildir.**

**(يَوْمَ يَنْظُرُ الْمَرْءُ مَا قَدَّمَتْ يَدَاهُ وَيَقُولُ الْكَافِرُ يَا لَيْتَنِي كُنْتُ تُرَابًا) Elə ki, qiyamət günündə hər bir kişi əlləri ilə daha əvvəl göndərdiyi əməllərinə baxar və o əməllər ondan ötrü zühur edər, o vaxt mömin öz əməlinə şad olar, amma kafir əzaba düçar olacağını görüb deyər: "Kaş mən torpaq halında qalıb, yenidən dirilməyib, məhşərə varid olmayaydım.**

Allaha həmd olsun, Ammə (ən-Nəbə) surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: "Kim Ammə surəsini oxusa, Allah-Təala qiyamət günündə ona elə bir soyuq şərab içirər ki, qiyamət gününün istiliyi daha ona təsir etməz.

## ən-NAZİAT SURƏSİ

79-cu surədir. Məkkədə nazil olub, 46 ayə, 197 kəlmə və 753 hərfdir.

وَالنَّازِعَاتِ غَرْقًا ﴿١﴾ وَالنَّاشِطَاتِ نَشْطًا ﴿٢﴾ وَالسَّابِحَاتِ سَبْحًا ﴿٣﴾ فَالسَّابِقَاتِ سَبْقًا ﴿٤﴾
فَالْمُدَبِّرَاتِ اَمْرًا ﴿٥﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (وَالنَّازِعَاتِ غَرْقًا) And* olsun o müqəddəs kəslərə ki, mücadilə edib, özlərini əyləncədən qoparıb, tövhid və ilahi əmrlərə tabe olub, itaət və bəndəliyə davam edirlər.**

**2) (وَالنَّاشِطَاتِ نَشْطًا) - Və and olsun o kəslərə ki, Allah-Təalanın əmr və qadağalarını öyrənib, itaət edərkən sevinc və fərəh üzrə olarlar.**

**(*Qeyd:** *"İslam ümməti bu ayələrə fikir verib, elm öyrənməyə yönəlib, cəhalətdən xilas olmayacaqmı? Bir halda ki, əzəmət və qüdrət sahibi olan Allah-Təala elm sahibi olan şəxslərə and içir, o halda elmdən üstün nə ola bilər? Cəhalət özü bir xəstəlik olmaqdan əlavə insanı elə xəbis və murdar sifətlərə də düçar edir ki, onların səbəbinə insan dünya və axirətdə fəlakətə məruz qalar. Dünyada hər bir gözəl və yaxşı şeyin əsası elmdir. Elm ağacından müxtəlif şirin meyvələr hasil olar. Sahibi onlardan həm dünyada, həm də axirətdə ləzzət alıb, onun sayəsində həmyaşıdlarından, yoldaşlarından üstün olar. Əmirəl-möminin Əli (ə.s) Kümeyl ibn Ziyada buyurub: "Ey Kümeyl, elm maldan yaxşıdır, çünki malı sən mühafizə edirsən, amma elm səni mühafizə edir. Görəsən, insanlıq bu uca kəlamın qiymətini anlaya bilirmi? İslam ümmətinin belə ayə və kəlamlara əməl etməməyindən daha çox, bu kimi kəlamları digər millətlərə isnad edib, o millətləri vəsf etməsi təəccüblüdür. Cəhalətdən və cahildən məqsəd təkcə oxuyub-yazmağı bilməyən şəxslər deyildir, əksinə bununla birlikdə xarici dil bilən, özünü böyük alim və islamın himayəçisi hesab edib, lakin nə Qurandan, nə də hədislərdən heç bir şeyə agah olmayanları nəzərdə tuturam. İslamın Qurani-Şərif kimi kitabından bixəbər olub, lakin xarici dillərdə mütəxəssis və filosof olan şəxslər cahil və na-dan adına layiq olub, özlərini dinin və müsəlmanların himayəçisi adlandırmaları əsl xətadır. İnsaf edin).*

**3) (وَالسَّابِحَاتِ سَبْحًا) - Və and olsun o kəslərə ki,** (üzgüçü suyun içində üz-düyü kimi) **elm və maarif dənizində üzüb, elm və maarif öyrənmək üçün səy edir.**

**4-5) (فَالسَّابِقَاتِ سَبْقًا فَالْمُدَبِّرَاتِ اَمْرًا) - Bu kəslər elm və maarifi öyrənməkdə**

يَوْمَ تَرْجُفُ الرَّاجِفَةُ ﴿٦﴾ تَتْبَعُهَا الرَّادِفَةُ ﴿٧﴾ قُلُوبٌ يَوْمَئِذٍ وَاجِفَةٌ ﴿٨﴾ اَبْصَارُهَا خَاشِعَةٌ ﴿٩﴾
يَقُولُونَ ءَاِنَّا لَمَرْدُودُونَ فِي الْحَافِرَةِ ﴿١٠﴾ ءَاِذَا كُنَّا عِظَامًا نَخِرَةً ﴿١١﴾ قَالُوا تِلْكَ اِذًا كَرَّةٌ خَاسِرَةٌ
﴿١٢﴾ فَاِنَّمَا هِيَ زَجْرَةٌ وَاحِدَةٌ ﴿١٣﴾ فَاِذَا هُمْ بِالسَّاهِرَةِ ﴿١٤﴾ هَلْ اَتٰيكَ حَدِيثُ مُوسٰى ﴿١٥﴾

---

**yarışıb, hər bir xeyir işi görmək üçün tədbir görərlər.** (Ey Məhəmməd), **bu şəxslərə and içirəm ki, həqiqətən qiyamət vaqe olub, siz yenidən dirilib, məsul olacaqsınız. Belə halda küfr və şirki tərk edib, öz cinsinizə, hətta heyvanlara da zülm etməyib, kamil insan olun.**

**6-7) (يَوْمَ تَرْجُفُ الرَّاجِفَةُ تَتْبَعُهَا الرَّادِفَةُ) - O gün ki, onun şiddət və dəhşətindən hər bir şey sarsılıb, onun qorxusundan rahat ola bilməzlər. İkinci sarsıntının şiddəti birincidən daha çox olar. Belə bir gündə dirilərsiniz.**

**8) (قُلُوبٌ يَوْمَئِذٍ وَاجِفَةٌ) Qiyaməti inkar edənlərin qəlbləri o gün şiddətli iztirab içində olar.**

**9) (اَبْصَارُهَا خَاشِعَةٌ) Gözləri də şiddətli qorxudan zəlilcəsinə aşağı dikilib, qorxduqları məlum olar.**

**10) (يَقُولُونَ ءَاِنَّا لَمَرْدُودُونَ فِي الْحَافِرَةِ)** - (Ey Məhəmməd), **qiyaməti inkar edənlər yenidən dirilmələrinə təəccüb edib, belə deyərlər: "Bəs biz öləndən sonra yenidən dirilib, əvvəlki halda olacağıq? Yox, bu, mümkün olan şey deyildir.**

**11) (ءَاِذَا كُنَّا عِظَامًا نَخِرَةً) Yenə deyərlər: "O zaman ki, biz çürümüş sümük olduq, yenə qayıdıb, diriləcəyik?**

**12) (قَالُوا تِلْكَ اِذًا كَرَّةٌ خَاسِرَةٌ) - Bu sözlərdən sonra istehza ilə dedilər: "Əgər** (Məhəmməd) **deyən doğru olub qiyamət olsa, o zaman bizim yenidən qayıdıb, dirilməmiz zərərli bir dönüş olacaqdır. Çünki biz qiyaməti inkar edirik.**

**13-14) (فَاِنَّمَا هِيَ زَجْرَةٌ وَاحِدَةٌ فَاِذَا هُمْ بِالسَّاهِرَةِ)** - (Ey Məhəmməd), **müşriklər yenidən dirilib, məhşərə gətirilmələrinin Allah-Təala üçün çətin olduğunu zənn etməsinlər. Həqiqətən, onların dirilməsi bizim qüdrətimizlə yaradılan bir səsə möhtacdır. Elə ki, bizim tərəfimizdən o səs yaradılıb, dəvət olundular, onların çürük sümükləri torpaqdan qalxıb, dirilib hamısı dərhal düz və ağ bir yerin üstündə hazır olarlar.** (Peyğəmbər (ə.s) insanların onu təkzib edib, Quranı qəbul etməmələri səbəbi ilə qəmgin və məhzun olduğu üçün Allah-Təala onu təsəlli edərək, növbəti ayələrdə Musanın fironla olan əhvalatını o cənaba bildirir).

**15) (هَلْ اَتٰيكَ حَدِيثُ مُوسٰى)** - (Ey Məhəmməd), **bəs Musanın fironla olan hekayəsi sənə gəlib çatıbmı? Əlbəttə, gərək onların əhvalatına agah olasan ki, səndən ötrü təsəlli olsun.**

اِذْ نَادٰيهُ رَبُّهُ بِالْوَادِ الْمُقَدَّسِ طُوًىۚ ﴿١٦﴾ اِذْهَبْ اِلٰى فِرْعَوْنَ اِنَّهُ طَغٰىۖ ﴿١٧﴾ فَقُلْ هَلْ
لَكَ اِلٰٓى اَنْ تَزَكّٰىۙ ﴿١٨﴾ وَاَهْدِيَكَ اِلٰى رَبِّكَ فَتَخْشٰىۚ ﴿١٩﴾ فَاَرٰيهُ الْاٰيَةَ الْكُبْرٰىۘ ﴿٢٠﴾
فَكَذَّبَ وَعَصٰىۘ ﴿٢١﴾ ثُمَّ اَدْبَرَ يَسْعٰىۘ ﴿٢٢﴾ فَحَشَرَ فَنَادٰىۘ ﴿٢٣﴾ فَقَالَ اَنَا۬ رَبُّكُمُ الْاَعْلٰىۘ
﴿٢٤﴾ فَاَخَذَهُ اللّٰهُ نَكَالَ الْاٰخِرَةِ وَالْاُو۫لٰىۜ ﴿٢٥﴾ اِنَّ فٖي ذٰلِكَ لَعِبْرَةً لِمَنْ يَخْشٰىۜ ﴿٢٦﴾

---

**16) (اِذْ نَادٰيهُ رَبُّهُ بِالْوَادِ الْمُقَدَّسِ طُوًىۚ) - O zaman ki, Musanın rəbbi Allah-Təala Tuva adlı müqəddəs çöldə onu çağırdı.**

**17) (اِذْهَبْ اِلٰى فِرْعَوْنَ اِنَّهُ طَغٰىۖ) Çağırandan sonra ona əmr etti: "Ey Musa, həqiqətən, firon** (Misirdə) **tüğyan edibdir, gedib onu küfr və zəlalətdən bizim tərəfimizə dəvət et.**

**18) (فَقُلْ هَلْ لَكَ اِلٰٓى اَنْ تَزَكّٰىۙ) Ey Musa, get firona de: şirk və küfrdən pak və təmiz olub, tövhid və imana daxil olmaq istəyirsənmi? (Belə mülayim şəkildə onu bizim tərəfimizə dəvət et).**

**19) (وَاَهْدِيَكَ اِلٰى رَبِّكَ فَتَخْشٰىۚ) - Və yenə firona de: "Səni rəbbin yeganə Allah-Təala tərəfinə hidayət etməmi istəyirsənmi? Ta ki, onu tanıyandan sonra onun əzabından qorxub, gərək küfr və şirki tərk edəsən.**

**20) (فَاَرٰيهُ الْاٰيَةَ الْكُبْرٰىۘ) Firon Musadan öz doğruluğu üçün möcüzə istədi. Musa da ona böyük dəlil və sübut göstərdi.**

**21) (فَكَذَّبَ وَعَصٰىۘ) Firon dəlili qəbul etməyib, Musanı təkzib edib, onun peyğəmbərliyinin doğruluğuna agah olandan sonra Allah-Təalaya asi olub, qəbul etmədi.**

**22) (ثُمَّ اَدْبَرَ يَسْعٰىۘ) - Ondan sonra Musadan üz döndərib, Musaya məkr, hiylə edib, onun işini batil etmək üçün çalışmağa başladı.**

**23-24) (فَحَشَرَ فَنَادٰىۘ فَقَالَ اَنَا۬ رَبُّكُمُ الْاَعْلٰىۘ) Sehrbazları və qövmünü toplayıb, onlara xitab edib dedi: "Sizin uca rəbbiniz** (Allah-Təalanız) **mənəm, məndən başqa tanrınız yoxdur. Musanın sözlərini qəbul etməyin.**

**25) (فَاَخَذَهُ اللّٰهُ نَكَالَ الْاٰخِرَةِ وَالْاُو۫لٰىۜ) Elə ki,** (firon) **asi oldu, Allah-Təala onu dünya və axirət əzabına yaxaladı.** (Dünyada suya qərq edib, axirətdə yandırdı).

**26) (اِنَّ فٖي ذٰلِكَ لَعِبْرَةً لِمَنْ يَخْشٰىۜ)** - (Ey Məhəmməd**), həqiqətən, firon və qövmünə əzab nazil olub, həlak olmalarında Allah-Təaladan qorxan şəxslərdən ötrü ibrət vardır. Gərək ibrət alıb, Allah-Təalanın itaətində olsunlar. Müşrik və asilər bu qissələrdən ibrət almazlarmı?**

ءَاَنْتُمْ اَشَدُّ خَلْقًا اَمِ السَّمَآءُ بَنٰيهَا ﴿٢٧﴾ رَفَعَ سَمْكَهَا فَسَوّٰيهَا ﴿٢٨﴾ وَاَغْطَشَ لَيْلَهَا وَاَخْرَجَ ضُحٰيهَا
﴿٢٩﴾ وَالْاَرْضَ بَعْدَ ذٰلِكَ دَحٰيهَا ﴿٣٠﴾ اَخْرَجَ مِنْهَا مَآءَهَا وَمَرْعٰيهَا ﴿٣١﴾ وَالْجِبَالَ اَرْسٰيهَا
﴿٣٢﴾ مَتَاعًا لَكُمْ وَلِاَنْعَامِكُمْ ﴿٣٣﴾ فَاِذَا جَآءَتِ الطَّآمَّةُ الْكُبْرٰى ﴿٣٤﴾ يَوْمَ يَتَذَكَّرُ الْاِنْسَانُ مَا
سَعٰى ﴿٣٥﴾ وَبُرِّزَتِ الْجَحِيمُ لِمَنْ يَرٰى ﴿٣٦﴾ فَاَمَّا مَنْ طَغٰى ﴿٣٧﴾ وَاٰثَرَ الْحَيٰوةَ الدُّنْيَا ﴿٣٨﴾
فَاِنَّ الْجَحِيمَ هِيَ الْمَاْوٰى ﴿٣٩﴾

---

**27) (ءَاَنْتُمْ اَشَدُّ خَلْقًا اَمِ السَّمَآءُ بَنٰيهَا) Siz ki, qiyaməti inkar edirsiniz, sizin yenidən yaradılmanız Allah-Təala üçün çətindir,** (halbuki birinci dəfə sizi yaradıbdır), **yoxsa səmanın yaradılması?** (Hansı ki, sizin həyatınızın səbəbidir). **Allah-Təala öz kamil qüdrəti ilə insanı yaratdı. Səmanın yaradılması Allah-Təalaya çətin olmadığı kimi sizin yenidən yaradılmanız da çətin olmaz.**

**28) (رَفَعَ سَمْكَهَا فَسَوّٰيهَا) Səmanı yuxarıya doğru ucaltdı, möhkəm və düz nizamladı ki, heç bir tərəfi artıq-əskik, yarıq olmasın.** (İnsanın başına nisbətlə səmaya yuxarı tərəf deyilir, yoxsa, həqiqətən, səma hər bir tərəfdən bizi əhatə edib, aşağı-yuxarı ifadələri ona aid deyil).

**29) (وَاَغْطَشَ لَيْلَهَا وَاَخْرَجَ ضُحٰيهَا) Səmanın gecəsini qaraldıb, gündüzünü açıq-aşkar nurani etdi.** (Gecə və gündüzün olmasına, günəşin doğmasına və batmasına yerin öz oxu ətrafında dönməsi səbəb olur, insanlara görə günəş səmada olduğundan Allah gecə-gündüzü səmaya isnad etdi).

**30) (وَالْاَرْضَ بَعْدَ ذٰلِكَ دَحٰيهَا) Səmanı yaratdıqdan sonra yeri döşəyib, sizdən ötrü yaydı ki, məişətiniz asan yolla təmin olunsun.**

**31) (اَخْرَجَ مِنْهَا مَآءَهَا وَمَرْعٰيهَا) Həmin yerdən onun suyunu və otlağını sizdən ötrü çıxartdı ki, özünüz və heyvanlarınız yerin suyundan və otlağından yeyib-içib, rahat olasınız.**

**32) (وَالْجِبَالَ اَرْسٰيهَا) - Dağları yerdə sabit və bərqərar etdi.**

**33) (مَتَاعًا لَكُمْ وَلِاَنْعَامِكُمْ) Qeyd olunan şeyləri Allah-Təala siz və sizin heyvanlarınız üçün ruzi etməkdən ötrü yaratdı.**

**34) (فَاِذَا جَآءَتِ الطَّآمَّةُ الْكُبْرٰى) - O zaman ki, bütün bəla və müsibətlərdən uca olan böyük bəla və müsibət (qiyamət) gəldi,**

**35) (يَوْمَ يَتَذَكَّرُ الْاِنْسَانُ مَا سَعٰى) - O gün ki, insan dünyada səy edib, qazandığı əməllərini görüb, unutmuş olsa da, sonradan yadına salar.**

**36) (وَبُرِّزَتِ الْجَحِيمُ لِمَنْ يَرٰى) Hər bir baxıb görən şəxslərdən ötrü (bütün məhşər əhlindən ötrü) cəhənnəm açıq-aşkar ortada olar. Hamısı görər.**

**37-39) (فَاَمَّا مَنْ طَغٰى وَاٰثَرَ الْحَيٰوةَ الدُّنْيَا فَاِنَّ الْجَحِيمَ هِيَ الْمَاْوٰى) Elə bir gündə və zamanda o şəxs ki, dünyada həddini aşıb, müşrik, ya da asi olub, öz nəfsani**

وَاَمَّا مَنْ خَافَ مَقَامَ رَبِّهٖ وَنَهَى النَّفْسَ عَنِ الْهَوٰىۙ ﴿٤٠﴾ فَاِنَّ الْجَنَّةَ هِيَ الْمَاْوٰىۜ ﴿٤١﴾ يَسْـَٔلُونَكَ عَنِ السَّاعَةِ اَيَّانَ مُرْسٰيهَاۜ ﴿٤٢﴾ فٖيمَ اَنْتَ مِنْ ذِكْرٰيهَا ﴿٤٣﴾

---

**istəklərinə tabe olub, dünya həyatını axirətdən üstün sayıb, axirəti tərk etdi, belə şəxsin məkan və mənzili cəhənnəmdir.**

**40-41) (وَاَمَّا مَنْ خَافَ مَقَامَ رَبِّهٖ وَنَهَى النَّفْسَ عَنِ الْهَوٰىۙ فَاِنَّ الْجَنَّةَ هِيَ الْمَاْوٰىۜ) Amma o şəxs ki, qiyamət günündə rəbbi Allah-Təalanın hüzurunda durub, hesab verməkdən qorxub, şəri əmr edən xəbis nəfsinə istəklərini* qadağan edib, ona mane olsa, həqiqətən, belə şəxsin məkan və mənzili cənnətdir.**

**42) (يَسْـَٔلُونَكَ عَنِ السَّاعَةِ اَيَّانَ مُرْسٰيهَاۜ)** - (Ey Məhəmməd), **qiyamət gününün nə vaxt vaqe olacağını səndən soruşurlar ki, Allah-Təala qiyaməti nə vaxt qoparacaqdır?**

**43) (فٖيمَ اَنْتَ مِنْ ذِكْرٰيهَاۜ)** - (Ey Məhəmməd), **onlardan ötrü qiyamət vaxtını deyə bilməyib, onun vaxtına agah olmayacaqsan.**

**(*Qeyd:** *“Abbasi xəlifələrindən Harun ər-Rəşid xanımı və əmisi qızı Zübeydə Cəfər qızının kənizlərindən birinə meyl etdi. Lakin nəfsinə bu işi qadağan edib, üz döndərdi. Zübeydə bu məsələdən agah oldu. Rəşid Zübeydə ilə bir yerdə olan zaman Zübeydə kəniz məsələsində ona hirslənib dedi: “Ey cəhənnəm əhli, mənim yanımdan get. Harun ər-Rəşid də hirslənib dedi: “Mən cəhənnəm əhli isəm, sən də məndən ayrılmış ol. Harun ər-Rəşid sakitləşəndən sonra Zübeydəni boşadığına peşman oldu. Alimləri toplayıb, bu haqda onlarla məşvərət etdi. Hamısı cavab verib dedilər: “Sənin cəhənnəm əhli olub-olmadığın dəqiq bilinmədiyinə görə Zübeydə səndən boşanmış sayılır. Neçə dəfə məclis qurub, bu haqda məşvərət etsə də, eyni cavabı eşitdi. Axırda təkidlə hökm verdi: “Əgər bunlardan başqa bir alim tapılsa, mənim hüzuruma gətirin. Vəzirlərdən biri ərz edib dedi: “Mənim qonşuluğumda Əbu Yusif adında bir alim vardır. Alim və arif bir şəxsdir. Lakin camaat içində məşhur olmayıb, özü də guşənişin bir adamdır. Hökm verdi ki, gətir. Dərhal məclis qurub, Bağdadın məşhur və məşhur olmayan bütün alimlərini topladı, Əbu Yusif də orada hazır olub, hamıdan aşağıda qapı ağzında əyləşdi. Harun ər-Rəşid həmin məsələni soruşub, yenə cavab istədi. Alimlər yenə Zübeydənin boşanmış olduğu cavabını verdilər. Əbu Yusif qapı ağzındad səsləndi: “Ya əmirəl-möminin, cavab mənim yanımdadır. Harun ər-Rəşid onu öz yanına çağırıb, əhvalatı əvvəldən axıra kimi ona nəql etdi. Əbu Yusif dedi: “Sən kənizi istədikdən sonra nəfsinə bu işi qadağan edib geri qayıtmadınmı? Harun ər-Rəşid dedi: “Bəli, geri qayıtdım, heç bir iş görmədim. Əbu Yusif dedi: “Belə olanda sən cəhənnəm əhli deyilsən və Zübeydə də səndən boşanmış deyildir. Çünki Allah-Təala Qurani-Şərifdə buyurur: “Amma o şəxs ki, qiyamət günündə rəbbi Allah-Təalanın hüzurunda durub, hesab verməkdən qorxub, şəri əmr edən xəbis nəfsinə*

اِلٰى رَبِّكَ مُنْتَهٰيهَاط﴿٤٤﴾ اِنَّمَآ اَنْتَ مُنْذِرُ مَنْ يَخْشٰيهَا ﴿٤٥﴾ كَاَنَّهُمْ يَوْمَ يَرَوْنَهَا لَمْ يَلْبَثُوٓا اِلَّا عَشِيَّةً
اَوْ ضُحٰيهَا ﴿٤٦﴾

---

*istəklərini qadağan edib, ona mane olsa, həqiqətən, belə şəxsin məkan və mənzili cənnətdir". Bu ayəyə görə sən cənnət əhlindən olub, Zübeydə də səndən boşanmış sayılmaz. Çünki onun boşanmış olmasını özünün cəhənnəmlik olması şərtinə bağlayıbsan. Şərt olmayanda, sən də cəhənnəmlik olmadığın üçün Zübeydənin boşanmaq məsələsi ləğv olur. Harun ər-Rəşid bu sözdən fövqəladə dərəcədə şad olub buyurdu: "Məni sevənlər Əbu Yusifə bəxşiş və hədiyyə versin. Vəzir və əmirlər Əbu Yusifün o qədər pul və bəxşiş tökdülər ki, yerindən qalxa bilmədi. Ondan sonra Harun ər-Rəşid ona daha çox bəxşiş verilməsini əmr etdi və əmr etdi ki, onu kəcavəyə mindirib, evinə aparsınlar. (Əmirlər bir yerə gedəndə kəcavədə, qulamların çiyinlərində oturub gedərdilər). Əbu Yusifi kəcavəyə mindirib, evinə apardılar. Əbu Yusifin bir yəhudi qonşusu var idi. Yəhudi evini bərpa edəndə divarın bir küncünü küçəyə çox çıxartmışdı. Əbu Yusif ona o vaxt demişdi: "Bu əməl yaxşı deyil, gəlib-gedənlərə mane olur. Yəhudi Əbu Yusifə istehza ilə demişdi: "Nə vaxt sən kəcavə ilə gəlib-gedəndə yol sənə dar gəlsə, o vaxt mən onu düzəldərəm. Elə ki, kəcavədəki Əbu Yusif o yerə çatdı, yəhudinin gətirilməsinə hökm verdi. Yəhudi gələndə ona dedi: "Divarın küncünü düzəltmək vaxtı gəlib-çatdı. Yəhudi – eşitdim və itaət edirəm deyib, divarın o qismini düzəldib, Əbu Yusifdən ötrü yol açıldı, o da gedib mənzilinə daxil oldu. Ondan sonra Harun ər-Rəşid Əbu Yusifi bütün islam dünyasının baş qazisi təyin etdi. Ondan sonra qazi Əbu Yusif məşhur oldu. Həqiqətən, qazi Əbu Yusifin bu məsələdəki izahı gözəl və məntiqə uyğundur. Bundan əlavə Əbu Yusifin Harun ər-Rəşid haqqında başqa hökmləri də vardır, lakin bu məqamda onları qeyd etmək münasib deyildir. Tarixçilərə onun hökmləri və dərin elm sahibi olması məxfi deyildir. Qəbri Bağdadda, Kazımiyyədə Musa ibn Cəfərin qəbrinin yaxınlığındadır. Əbu Yusif öz dövrünün istedadlı və dahi bir şəxsiyyəti idi).*

**44) (اِلٰى رَبِّكَ مُنْتَهٰيهَاط) - (Ey Məhəmməd), qiyamət elminin təfərrüatı sənin rəbbin Allah-Təalaya aiddir. Onun vaxtına Allah-Təaladan başqa agah olan olmaz.**

**45) (اِنَّمَآ اَنْتَ مُنْذِرُ مَنْ يَخْشٰيهَا)** - (Ey Məhəmməd), **sən qiyamət gününün vaxtını onlara bildirmək üçün göndərilməmisən. Əksinə, həqiqətən, sən ancaq qiyamətin dəhşətindən qorxan şəxsləri çəkindirməkdən ötrü göndərilmisən. Sən insanları qorxut, qiyamətin vaxtını soruşanlardan üz döndər.**

**46) (كَاَنَّهُمْ يَوْمَ يَرَوْنَهَا لَمْ يَلْبَثُوٓا اِلَّا عَشِيَّةً اَوْ ضُحٰيهَا) Qiyaməti inkar edənlər qiyaməti görən zamanda onlara elə məlum olar ki, sanki dünyada ömür sürməyib və müvəffəqiyyət qazanmayıblar. Ancaq bir axşam, ya da bir sübh**

**vaxtı qədər ömür sürüblərlər. Dünyadakı ömür müddətlərini axirətin müqabilində az bir zaman hesab edərlər.**

Allaha həmd olsun, ən-Naziat surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: “Kim ən-Naziat surəsini oxusa, Allah-Təala onu qəbrində və qiyamətdə az bir müddətdən çox saxlamayıb cənnətə daxil edər.

## ƏBƏSƏ SURƏSİ

80-ci surədir. Məkkədə nazil olub, 41 ayə, 130 kəlmə və 533 hərfdir.

عَبَسَ وَتَوَلّٰىۙ ﴿١﴾ اَنْ جَٓاءَهُ الْاَعْمٰىؕ ﴿٢﴾

**Bismillahir-Rəhmanir-Rəhim**

Peyğəmbər (ə.s) Məkkədə olarkən bir məclis təşkil etdi, o məclisdə Qüreyş əsilzadələrindən Utbə və Şeybə ibn Rabiə, Əbu Cəhl ibn Hişam, Abbas ibn Əbdülmüttəlib, Ümeyyə ibn Xələf, Vəlid ibn Müğirə və başqa əsilzadələr də var idi. Allahın Rəsulu onları islama dəvət edib, onların müsəlman olması ilə digər Qüreyş qəbilələrinin islama daxil olacağına ümid etdiyi üçün o məclisə başqa şəxslərin girməsini istəmədi. Onlarla söhbət edən vaxt Qüreyşin Bəni Fəhr qəbiləsinin ilk müsəlmanlarından İbn Ümmi Məktum ləqəbli Abdullah ibn Şüreyh adlı bir kor məclisə daxil oldu. Peyğəmbərin o camaatla zəruri söhbəti olduğunu bilməyib dedi: “Ey peyğəmbər, Allah-Təalanın sənə öyrətdiyi Qurandan oxuyub mənə də öyrət. Bu istəyini bir neçə dəfə təkrarladı. Peyğəmbər onun sualına etina etməyib, üz döndərib, cavab vermədi və onun o halda məclisə daxil olmasından incidi. O vaxt Əbəsə surəsi nazil oldu. Surənin əvvəlində Allah-Təala İbn Ümmi Məktuma etina etməyib, ondan üz döndərdiyi üçün peyğəmbəri qınayır. (Yəni bir nəfər kor mömin şəxsə ehtiram etmək bir çox kafirə hörmət etməkdən daha vacibdir. Kafirlərə görə bir nəfər kor dindar şəxsə etinasızlıq eləmək, üz-gözünü turşutmaq caiz deyildir. Hərçənd gözləri kor olan şəxs bunu görməsə də, hər bir müsəlmana hörmət etmək lazımdır. Bu ayə bizdən ötrü əbədi bir dərsdir. Müsəlmanlar gərək Quran ayələrindən nümunə götürərək, müsəlmanların qardaşlığı, bərabərliyi, özü möhtac olsa da başqalarına yardım etmək kimi əhəmiyyətli məsələləri anlasınlar. Peyğəmbərin hədislərində deyildiyi kimi – “bir mömin digər bir mömindən ötrü möhkəm bir bina kimidir, bir-birlərini qüvvətləndirərlər” və “möminlərin hamısı bir əl kimidir”. Müsəlmanlar gərək ittifaq və birliyi özlərinə şüar edib, əsrlərdir içlərində olan xəbis nifaq ağacının kökünü kəsmək üçün səy etməyi islamın əsas şərtlərindən saysınlar. Birlik, ittifaq, vətənpərvərlik, məşvərət kimi məsələlərə bu ayədən artıq dəlil və sübut lazımdırmı? Bu mübarək surə nazil olandan sonra peyğəmbər nə zaman İbn Ümmi Məktumu görsə deyərdi: “Salam olsun o şəxsə ki, ona görə rəbbim Allah-Təala qəzəblənib, məni qınadı. Bir ehtiyacın varmı? Bu ayənin ortaya qoyduğu incəliklərə diqqət etmək lazımdır. Bundan sonra surənin təfsiri başlayır).

**1-2) (عَبَسَ وَتَوَلّٰىۙ اَنْ جَٓاءَهُ الْاَعْمٰىؕ)** (Əvvəlcə xitab etməyib, birbaşa qınamaq,

وَمَا يُدْرِيكَ لَعَلَّهُ يَزَّكّٰىۙ ﴿٣﴾ اَوْ يَذَّكَّرُ فَتَنْفَعَهُ الذِّكْرٰىۜ ﴿٤﴾ اَمَّا مَنِ اسْتَغْنٰىۙ ﴿٥﴾ فَاَنْتَ لَهُ تَصَدّٰىۜ ﴿٦﴾ وَمَا عَلَيْكَ اَلَّا يَزَّكّٰىۜ ﴿٧﴾ وَاَمَّا مَنْ جَٓاءَكَ يَسْعٰىۙ ﴿٨﴾ وَهُوَ يَخْشٰىۙ ﴿٩﴾ فَاَنْتَ عَنْهُ تَلَهّٰىۚ ﴿١٠﴾ كَلَّٓا اِنَّهَا تَذْكِرَةٌۚ ﴿١١﴾

---

ondan sonra xitab etmək töhmətin şiddətinə dəlil və sübutdur). **Buyurur:** (Məhəmməd) **kor kişi** (İbn Ümmi Məktum) **onun yanına gəldiyi üçün üz-gözünü turşudub, ondan üz döndərib, cavab vermədi ki, niyə o vaxt onun yanına gəldi? Belə iş nəinki peyğəmbərlərə, hətta heç bir müsəlmana layiq deyildir. Müsəlmanlar gərək bir-birlərini düşünüb, islamı mühafizə etsinlər.**

**3) (وَمَا يُدْرِيكَ لَعَلَّهُ يَزَّكّٰىۙ)** - (Ey Məhəmməd), **hansı şey səni bu kor şəxsin halına agah etdi? Sən ki, onun halından agah deyilsən. Gəlib səndən din ehkamını soruşdu. Bəlkə səndən öyrəndiyi ehkamın səbəbinə nəfsini təmizləyib, xəbis sifətlərdən pak olacaqdı. Nədən ötrü sən ondan üz döndərib, istədiyi elmi ona öyrətmədin?**

**4) (اَوْ يَذَّكَّرُ فَتَنْفَعَهُ الذِّكْرٰىۜ) - Bəlkə də sənin öyüd-nəsihətindən agah olub, mənfəət əldə edəcək idi. Qüreyş camaatı ila məşğul olub, ehkam deməyi, öyüd-nəsihət etməyi o kordan əsirgədin.** (Ey Məhəmməd), **belə əməlləri tərk et, bundan sonra səndən belə əməl meydana gəlməsin.**

**5-6) (اَمَّا مَنِ اسْتَغْنٰىۙ فَاَنْتَ لَهُ تَصَدّٰىۜ) Amma o şəxslər** (Qüreyş camaatı) **ki, Allah-Təalaya iman gətirməyə ehtiyac hiss etməyib, səni təkzib edir, sən üzünü onlara tərəf çevirib, sözlərinə qulaq asırsan, halbuki belə inadkar şəxslərin sözlərinə qulaq asmaq lazım deyildir.**

**7) (وَمَا عَلَيْكَ اَلَّا يَزَّكّٰىۜ)** - (Ey Məhəmməd), **sən səy edirsən ki, onlar imana daxil olub pak olsunlar. Onların imana daxil olmayıb, şirkdən pak olmamalarından sənə heç bir zərər yoxdur. Sənin vəzifən ancaq peyğəmbərliyi təbliğ etməkdir.**

**8-9) (وَاَمَّا مَنْ جَٓاءَكَ يَسْعٰىۙ وَهُوَ يَخْشٰىۙ) Amma o şəxs ki,** (İbn Ümmü Məktum) **Allah-Təaladan qorxduğu halda xeyir istəməyə tələsib, sənin yanına din ehkamını öyrənmək üçün gəldi,**

**10) (فَاَنْتَ عَنْهُ تَلَهّٰىۚ)** - (Ey Məhəmməd), **sən ondan üz döndərib, ona cavab verməyib, Qüreyş müşrikləri ilə məşğul olursan. Xüsusən sənin kimi peyğəmbərlik mənsəbinə nail olan şəxslərdən belə əməllərin meydana gəlməsi layiq deyildir.**

**11) (كَلَّٓا)** - (Ey Məhəmməd), **bundan sonra belə iş görmə. Müsəlmanlara hörmət və ehtiram et. (اِنَّهَا تَذْكِرَةٌ) - Bu qeyd olunanlar öyüd-nəsihətdir. Hər bir eşidən şəxsi qəbul edib, əməl etmək vacibdir.** (Bütün islam ümməti

فَمَنْ شَآءَ ذَكَرَهُ ۢ﴿١٢﴾ فِي صُحُفٍ مُكَرَّمَةٍ ۙ﴿١٣﴾ مَرْفُوعَةٍ مُطَهَّرَةٍ ۙ﴿١٤﴾ بِاَيْدِي سَفَرَةٍ ۙ﴿١٥﴾
كِرَامٍ بَرَرَةٍ ؕ﴿١٦﴾ قُتِلَ الْاِنْسَانُ مَآ اَكْفَرَهُ ؕ﴿١٧﴾ مِنْ اَيِّ شَيْءٍ خَلَقَهُ ؕ﴿١٨﴾ مِنْ نُطْفَةٍ ؕ خَلَقَهُ فَقَدَّرَهُ
ۙ﴿١٩﴾ ثُمَّ السَّبِيلَ يَسَّرَهُ ۙ﴿٢٠﴾ ثُمَّ اَمَاتَهُ فَاَقْبَرَهُ ۙ﴿٢١﴾

---

gərək bu ayələrə və bundan başqa qardaşlıq, bərabərlik və camaat barəsində varid olan ayələrə tabe olub, dünya və axirətdə düz adam olmağı onlara bağlı bilib, əməl etməyi vacib saysınlar).

**12) (فَمَنْ شَآءَ ذَكَرَهُ) Hər bir şəxs istəsə öz ixtiyarı ilə bu öyüd-nəsihətə agah olub, yadında saxlayıb, onlara əməl etməyi özünə vacib sayar. İnsan hər bir əməlində azaddır. Qəbul etməyəndə öz ixtiyarı ilə qəbul etməyib tərk edir. O vaxt da ona əzab edilər.**

**13) (فِي صُحُفٍ مُكَرَّمَةٍ) - Bu öyüd-nəsihətlər təkcə Qurani-Şərifdə yox, Allah-Təalanın yanında əziz və hörmətli olan digər peyğəmbərlərə də nazil olan səhifələrin hamısında qeyd olunub.**

**14) (مَرْفُوعَةٍ مُطَهَّرَةٍ) - O səhifələrin qədir-qiyməti ədalət və insaf-mürüvvətə işarə edən kəlamları ehtiva etdiyindən pak və ucadır.**

**15-16) (بِاَيْدِي سَفَرَةٍ كِرَامٍ بَرَرَةٍ) - O səhifələr müttəqi, yaxşı əməl sahibi və bizim yanımızda əziz, möhtərəm olan peyğəmbərlərin əllərində olub, bizim tərəfimizdən o səhifələrlə insanları dəvət etməklə məsul olublar.**

**17) (قُتِلَ الْاِنْسَانُ مَآ اَكْفَرَهُ)** (Ey Məhəmməd), **bu insan** (müşriklər) **qətl edilsin.** (Dünya əhlinin adəti üzrə bədduadır). **Allah-Təalanın nemətinə və lütfünə, rəhmət və mərhəmətinə baxmayıb, nə şiddətli küfr edib, Allah-Təalaya iman etmirlər.** (Növbəti ayələrdə Allah-Təala insanın halını ta yaradılışdan sonuna kimi bəyan edir).

**18) (مِنْ اَيِّ شَيْءٍ خَلَقَهُ)** - (Ey Məhəmməd), **bilirsən ki, Allah-Təala insanı hansı həqir və əskik şeydən yaradıbdır?**

**19) (مِنْ نُطْفَةٍ خَلَقَهُ فَقَدَّرَهُ) - İnsanı spermadan yaradıb,** (hansı ki, ondan həqir və əskik bir şey yoxdur). **Allah-Təala özü istədiyi kimi onun vücudunu təqdir edib, dünyaya gətiribdir.**

**20) (ثُمَّ السَّبِيلَ يَسَّرَهُ) - İnsanı yaradandan sonra** (ona verdiyi ağılla) **xeyir və şər yolunu ondan ötrü asanlaşdırıb, istədiyi yolu getməkdə onu azad edibdir.** (Hər bir əməlin qarşılığını öz sahibinə verməK məntiqi olaraq vacib olduğu üçün Allah-Təalanın əməlində məcburiyyət olmayıb, insanın hər bir əməli öz ixtiyarı ilə ondan meydana gələr).

**21) (ثُمَّ اَمَاتَهُ فَاَقْبَرَهُ) - Ondan sonra hər bir insanın müəyyən əcəli yetişən zaman onu öldürüb, yeraltında onu* qəbrə qoymağı əmr etdi. Digər**

**heyvanlar kimi insanın bədəninin yırtıcı heyvanlar tərəfindən yeyilməsinə razı olmadı.**

**(*Qeyd:** *"Qurani-Şərifdə vaqe olan bu ayənin açıq-aşkar bildirməsinə görə meyiti qəbirdə dəfn etmək islamın vacib hökmlərindəndir. Qurani-Şəriflə sabit olan bir hökmə başqa bir məna vermək bidətdir və hər bidət də zəlalətdir. Zəlalət sahibi axirətdə Allah-Təalanın qəzəbinə düçar olacaqdır. Meyiti qəbrə qoymaq Qurani-Şərifdə əmr olunduğu kimi qəbrin və qəbrə qoymağın xüsusiyyəti də müqəddəs islam şəriətinin sahibindən onun öz uca səhabələri vasitəsilə bizə çatıbdır. Onun ziddini eləmək şəriət sahibinə qarşı çıxmaqdır. Qəbrə qoymağın xüsusiyyəti belədir: "Yeri qazıb, meyiti yerin içində, dərin şəkildə dəfn etmək vacibdir. Elə olmalıdır ki, meyitin bədəni yırtıcı heyvanların onu dağıtmasından qorunmuş olub, pis qoxusu ətrafa yayılmasın. Əgər bu üç şərtin biri tam olmasa, haram və şəriətə zidd olar. Əgər yer üzündə möhkəm bir qəbir düzəldilib, meyit oraya qoyulsa, bədəni də heyvanlardan qorunmuş olub, qoxusu da yayılmasa, yenə də şəriətə zidd və haram olub, meyitin haqqı verilməyibdir. Ya da elə olar ki, meyitin qoxusu yayılıb, camaata əziyyət edər, bizim bu dövrdə şəriətə zidd belə əməllərə qurşanıb, ölünü dəfn etməmək müsəlmanların arasında rəvac tapıb, şəriət qanunu sayılıbdır. Bəzən illərlə meyit dəfn edilməyib, hissələri parçalanıb, dağılar. Ölünü dəfn etməmənin şəriətə zidd olması açıq-aşkardır. Belə zidd əməllərdən biri də meyiti ziyarətgahda, pirlərin, imamların yanında dəfn edəcəyəm - deyib, yer üzündə bir yer düzəldib, meyiti ora qoymaqdır. Bu şəkildə yer düzəldib, şəriətə zidd şəkildə ölünün ayaqlarını qiblə tərəfə, başını şimal tərəfə qoyub, uzun illər onun parçalanıb dağılmasını gözləyirlər. Daha sonra sümüklərini toplayıb, bir sandığa qoyub, xeyli məsrəf çəkib, pirlərə, ziyarətgahlara, Kərbəlaya, ya da Nəcəfə aparıb, orada dəfn edirlər. Guya o vaxt böyük bir feyzə qovuşurlar. Qurani-Şərifdə, ya da hədislərdə belə şey varmı? Halbuki Quran, hədislər və peyğəmbərin əməlləri bunun əksinədir. Uhud savaşında o cənabın əmisi Həmzə şəhid oldu. O vadidə də onun dəfn edilməsini əmr etdi. Mədinədəki şəhidlər qəbristanına aparıb, dəfn etməyə izin vermədi. Mədinəyə qayıdandan sonra o cənaba xəbər verdilər ki, Mədinə əhli Uhud savaşında ölənlərin cəsədini Baqi qəbristanında dəfn etməyə aparır. O cənab cəsədləri geri qaytarıb, Uhud vadisində dəfn etməyi əmr etdi, halbuki qəbirləri artıq qazılmışdı. Lakin bir nəfəri qəbrə salmışdılar, onu oradan çıxartmağa razı olmayıb, üstünü örtməyi əmr etdi. Ey ağıl sahibləri, ibrət alın. Şəriət sahibinin ölünü qəbirdən çıxarmağı haram etməsinin hikməti meyitin bədənini dağılmış və başqa bir hala dönmüş şəkildə görməməkdir. Amma şəriət sahibinin məqsədinə zidd iş görüb, dəfələrlə bu haram işi təkrar edib, ölünün cəsədini başqa bir yerə nəql etmək bəhanəsi ilə ona hörmətsizlik edib, şəriət sahibinin qanununa əks iş görürlər. Din alimləri əsli olmayan belə əməlləri qınamalıdırlar. Heç bir dəlili olmayan, şəriətə zidd belə əməlləri insanların arasında yayıb, şəriət kimi göstərmənin səbəbi nədir? Allah-Təala hidayət versin!)*

ثُمَّ اِذَا شَآءَ اَنْشَرَهُ ﴿٢٢﴾ كَلَّا لَمَّا يَقْضِ مَآ اَمَرَهُ ﴿٢٣﴾ فَلْيَنْظُرِ الْاِنْسَانُ اِلٰى طَعَامِهٖ ﴿٢٤﴾ اَنَّا صَبَبْنَا
الْمَآءَ صَبًّا ﴿٢٥﴾ ثُمَّ شَقَقْنَا الْاَرْضَ شَقًّا ﴿٢٦﴾ فَاَنْبَتْنَا فِيهَا حَبًّا ﴿٢٧﴾ وَعِنَبًا وَقَضْبًا ﴿٢٨﴾ وَزَيْتُونًا
وَنَخْلًا ﴿٢٩﴾ وَحَدَآئِقَ غُلْبًا ﴿٣٠﴾ وَفَاكِهَةً وَاَبًّا ﴿٣١﴾ مَتَاعًا لَكُمْ وَلِاَنْعَامِكُمْ ﴿٣٢﴾ فَاِذَا
جَآءَتِ الصَّآخَّةُ ﴿٣٣﴾ يَوْمَ يَفِرُّ الْمَرْءُ مِنْ اَخِيهِ ﴿٣٤﴾ وَاُمِّهٖ وَاَبِيهِ ﴿٣٥﴾ وَصَاحِبَتِهٖ وَبَنِيهِ ﴿٣٦﴾

---

**22) (ثُمَّ اِذَا شَآءَ اَنْشَرَهُ) - Öləndən sonra Allah-Təala nə zaman istəsə, insanı yenidən dirildər.**

**23) (كَلَّا) - İnsan, gərək, təkəbbürlənməyi tərk edib, küfr və şirkdən Allah-Təala tərəfinə dönsün. (لَمَّا يَقْضِ مَآ اَمَرَهُ) - İnsan nəsli zaman içində bir-birinin dalınca gəlib-gedir, amma Allah-Təalanın əmr etdiyi şeyləri tam olaraq etmir.**

**24) (فَلْيَنْظُرِ الْاِنْسَانُ اِلٰى طَعَامِهٖ) - İnsan gərək həyatını davam etdirən yeməyinə baxıb, fikir versin ki, necə biz onun işini tənzim edib, hər bir növ yeməyi ondan ötrü hazır etmişik.**

**25) (اَنَّا صَبَبْنَا الْمَآءَ صَبًّا) - İnsanın yeməyini belə tənzim etdik, həqiqətən, biz öz kamil qüdrətimizlə yer üzünə buludlardan bol yağış tökdük.**

**26) (ثُمَّ شَقَقْنَا الْاَرْضَ شَقًّا) - Ondan sonra yağış səbəbi ilə dənlərin göyərməsi üçün yeri yardıq.**

**27) (فَاَنْبَتْنَا فِيهَا حَبًّا) Yeri yarandan sonra ondan insanın qidası olan dənləri göyərtdik.**

**28-29) (وَعِنَبًا وَقَضْبًا وَزَيْتُونًا وَنَخْلًا) Yenə yağış səbəbi ilə yer üzündə üzüm ağacı və həmişə təptəzə olan tərəvəz, zeytun və xurma ağacını yetişdirdik.**

**30) (وَحَدَآئِقَ غُلْبًا) Habelə böyük ağacları əhatə edən bağları onlardan ötrü yetişdirdik.**

**31) (وَفَاكِهَةً وَاَبًّا) - Və yenə insandan ötrü hər bir növ meyvə və onun heyvanları üçün otlaq yetişdirdik.**

**32) (مَتَاعًا لَكُمْ وَلِاَنْعَامِكُمْ) Ey Adəm övladı, bunların hamısı sizin və heyvanlarınız üçün ruzidir. Belə nemətlərə şükür etməyib, küfr edirsiniz?**

**33) (فَاِذَا جَآءَتِ الصَّآخَّةُ) - O zaman ki, Allah-Təala tərəfindən şiddətli səs gələr, onun həqiqətini dərk edib, qulaq asmaq və hesab vermək üçün hazır olarlar.**

**34-35-36) (يَوْمَ يَفِرُّ الْمَرْءُ مِنْ اَخِيهِ وَاُمِّهٖ وَاَبِيهِ وَصَاحِبَتِهٖ وَبَنِيهِ) - O gün** (qiyamət günü) **hər kəs qardaşından, ata-anasından, arvadından və oğullarından qaçar.**

لِكُلِّ امْرِئٍ مِنْهُمْ يَوْمَئِذٍ شَأْنٌ يُغْنِيهِ ﴿٣٧﴾ وُجُوهٌ يَوْمَئِذٍ مُسْفِرَةٌ ﴿٣٨﴾ ضَاحِكَةٌ مُسْتَبْشِرَةٌ ﴿٣٩﴾
وَوُجُوهٌ يَوْمَئِذٍ عَلَيْهَا غَبَرَةٌ ﴿٤٠﴾ تَرْهَقُهَا قَتَرَةٌ ﴿٤١﴾ أُولَٰئِكَ هُمُ الْكَفَرَةُ الْفَجَرَةُ ﴿٤٢﴾

---

**37) (لِكُلِّ امْرِئٍ مِنْهُمْ يَوْمَئِذٍ شَأْنٌ يُغْنِيهِ) - O gün hər kəsin özünə kifayət edən bir dərdi olar. Başqa şəxslərin dərdinə** (qohum da olsa) **diqqət etməyib, yardım istəyənlərdən üz döndərib, öz işi ilə məşğul olar.**

**38-39) (وُجُوهٌ يَوْمَئِذٍ مُسْفِرَةٌ ` ضَاحِكَةٌ مُسْتَبْشِرَةٌ)** (Ey Məhəmməd) **ogünkü gündə bəzi üzlər** (möminlərin üzləri) **əbədi nemətlərə qovuşduğu üçün nurani, sevincli və gülərüz olar.**

**40-41) (وَوُجُوهٌ يَوْمَئِذٍ عَلَيْهَا غَبَرَةٌ تَرْهَقُهَا قَتَرَةٌ) Amma ogünkü gündə bəzi üzləri çoxlu qəm-qüssədən sanki toz-torpaq, his bürüyübdür. Son dərəcə qorxu içində olarlar.**

**42) (أُولَٰئِكَ هُمُ الْكَفَرَةُ الْفَجَرَةُ)** - (Ey Məhəmməd), **qiyamətdə bu halda dirilənlər Allah-Təalaya küfr edib,** (insanlara) **zülm edən şəxslərdir.**

Allaha həmd olsun, Əbəsə surəsinin təfsiri tamamlandı, bu surədə və bundan sonra gələn surələrdə qiyamətin isbatı üçün qeyd olunan ayələr kifayət edər, bunları inkar edənlər islamın xaricindədirlər. Allahın Rəsulu buyurdu: “Kim Əbəsə surəsini oxusa, üzündə fərəh və sevinc əlaməti olduğu halda gülərək qiyamətə gələr”.

## ət-TƏKVİR SURƏSİ

81-ci surədir. Məkkədə nazil olub, 27 ayə, 104 kəlmə və 530 hərfdir.

إِذَا الشَّمْسُ كُوِّرَتْ ۙ ﴿١﴾ وَإِذَا النُّجُومُ انْكَدَرَتْ ۙ ﴿٢﴾ وَإِذَا الْجِبَالُ سُيِّرَتْ ۙ ﴿٣﴾ وَإِذَا الْعِشَارُ عُطِّلَتْ ۙ ﴿٤﴾ وَإِذَا الْوُحُوشُ حُشِرَتْ ۙ ﴿٥﴾ وَإِذَا الْبِحَارُ سُجِّرَتْ ۙ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) ( إِذَا الشَّمْسُ كُوِّرَتْ )** (On üç ayədə bildirilən əlamətlər qiyamət günündə vaqe olan əlamətlərdəndir). **Buyurur: "O zaman ki günəşin işığı yayılmaqdan azalmağa doğru dəyişib** (sönüb), **zülmət ona hakim olub məhv olacaq.**

**2) (وَإِذَا النُّجُومُ انْكَدَرَتْ) - Və o zaman ki, ulduzların hamısı öz mərkəzlərindən qopub, dağılacaq,**

**3) (وَإِذَا الْجِبَالُ سُيِّرَتْ) - Və o zaman ki, dağlar yer üzündən qoparılıb, yerdən uzaqlaşıb, toz kimi məhv olacaq,**

**4) (وَإِذَا الْعِشَارُ عُطِّلَتْ) - Və o zaman ki, on aylıq boğaz dəvələr çobansız və sahibsiz tərk olunub, yaddan çıxarılacaq,** (halbuki boğaz dəvələr onuncu aya daxil olanda sahibləri olan ərəblər onları son dərəcə əzizləyib, gecə-gündüz onları müşayiət edib, doğana qədər yanından ayrılmazdılar, lakin qiyamət gününün qorxusundan belə əziz mallarını unudarlar. Bu səbəbdən qiyamət gününün qorxusundan hər bir şeydən qafil olub, ancaq özləri ilə məşğul olduqları üçün ərəblərin on aylıq boğaz dəvələrdən qafil olmasını Allah-Təala burada qeyd edir).

**5) (وَإِذَا الْوُحُوشُ حُشِرَتْ) - Və o zaman ki, yer üzündə mövcud olan vəhşi heyvanlara ölüm gəlib, onlardan heç nə yer üzündə tapılmayacaq,** (İbn Abbas deyir: "Heyvanların bir yerə toplanması onların həlak olub, yer üzündən yox olması deməkdir").

**6) (وَإِذَا الْبِحَارُ سُجِّرَتْ) - Və o zaman ki, dənizlərin hamısı quruyub, bir damcı su onlarda qalmayıb, yerin hərarəti şiddətlə çoxalacaq, bu ayə Avropa alimlərinin bu sözünü təsdiq edir ki, yerin ömrü bitəndə günəşə yaxın olub, yanar, daha yerdə heç bir canlı tapılmaz, onların bu kəlamları bu ayəyə uyğun olub, gözəl sözdür. Əgər qiyamətin vaqe olacağına inanıb, müvəhhid** (tövhidə inanan) **olsaydılar, daha da gözəl olardı. Avropa alimlərinin xəbər verdiyi sözlərin hamısı Qurani-Şərifdə bizə bildirilibdir, la-**

وَاِذَا النُّفُوسُ زُوِّجَتْ ۙ ﴿٧﴾ وَاِذَا الْمَوْؤُ۫دَةُ سُئِلَتْ ۙ ﴿٨﴾ بِاَيِّ ذَنْبٍ قُتِلَتْ ۚ ﴿٩﴾ وَاِذَا الصُّحُفُ نُشِرَتْ ۙ ﴿١٠﴾

---

**kin biz dinimizdən bixəbər olduğumuz üçün bu elmləri Avropalılardan alıb, hətta bununla fəxr edirik. Müsəlmanlar Qurani-Şərifin göstərdiyi elmlərə agah olmadığı üçün cəhalətə düçar olublar. Bunun səbəbi də din və ümmət rəislərinin öz aralarındakı ixtilaf və Quran elmlərini gizlətməsidir. Anlayın!**

**7) (وَاِذَا النُّفُوسُ زُوِّجَتْ) - Və o zaman ki, ruhlar yaradılan bədənlərinə qovuşub, məhşərə varid olacaq,**

**8-9) (وَاِذَا الْمَوْؤُ۫دَةُ سُئِلَتْ ۙ بِاَيِّ ذَنْبٍ قُتِلَتْ) - Və o zaman ki,** *(qiyamətdə Allah-Təala tərəfindən)* **torpaq* altında basdırılıb, öldürülən qızlardan hansı günaha görə öldürüldükləri soruşulacaq,**

(***Qeyd:** *"Qanun-qaydaya görə qatildən soruşulmalıdır, lakin torpaq altındakı məsum qız uşaqlarına sual verilməsi qatillərin lal olub, heç bir sözə cavab tapmayıb aciz qalmaları səbəbi ilədir. Çünki qız uşaqları cavab verəndə ki, biz kiçik olduğumuz halda nə günahımız var idi ki, bizi həlak etdilər? Belə vaxtda qatillər cavab verə bilməyib aciz qalıb, lal olacaqlar. Ərəblərin ağaları qız uşağı olanda əgər onu öldürmək istəməsəydilər, böyüyəndən sonra ona yundan, ya da ki, tükdən bir cübbə geydirib dəvə, ya da qoyun otarmağa göndərərdilər, əgər öldürmək istəsəydilər, qızı altı yaşına qədər sağ qoyardılar, daha sonra anasına deyərdilər: "Bu qızı bəzə, ətir vur, dayılarının yanına aparacağam. Əvvəlcədən səhrada ondan ötrü bir quyu qazardılar. Qızı quyunun yanına aparıb, deyərdilər: "Qızım, bu quyuya bax, qız quyuya baxanda arxasından itələyib, quyuya salıb, üstünə torpaq tökərdilər. Hərçənd qız ah-nalə edib deyərdi: "Ata, məni niyə burada qoyub, üstümə torpaq tökürsən? Zalım ata qulaq asmayıb, quyunu doldurub, qızını bu şəkildə öldürərdi. Ya da ki, bəzən qadın doğarkən ərinin qorxusundan yeri qazıb üstündə doğmaq üçün oturardı, elə ki, doğdu, uşağa baxardı. Əgər oğlan olsa, götürüb fərəh və sevinclə ərinə müjdə verərdi. Amma əgər qız olsaydı, həmin yerdə torpağı onun üstünə töküb, həlak edərdi. Bu əməl ərəblərin əyanlarına məxsus idi, digər ərəblərdən qızlarını öldürənlər haqqında bu kitabın I cildində Ən`am surəsinin 140-cı ayəsinin təfsirinin qeydində məlumat verilib, oraya baxın).*

**10) (وَاِذَا الصُّحُفُ نُشِرَتْ) - Və o zaman ki** (insanların) **əməl dəftərləri paylanıb, hər kəsin əməl dəftəri özünə verilər, xeyir və şər nə əməl edibsə, hamısının o dəftərdə qeyd olunduğunu görəcək,** (axirətin xüsusiyyətini dünya əhlinə olduğu kimi bildirmək mümkün deyil, ancaq insanların dünyada agah olduqları şeylərlə onu anlatmaq mümkündür. Bu səbəbdən Allah-Təala öz kamil qüdrəti ilə insanların əməllərini qeyd edib, onları qiyamət günündə

وَاِذَا السَّمَآءُ كُشِطَتْ ﴿١١﴾ وَاِذَا الْجَحِيمُ سُعِّرَتْ ﴿١٢﴾ وَاِذَا الْجَنَّةُ اُزْلِفَتْ ﴿١٣﴾ عَلِمَتْ
نَفْسٌ مَآ اَحْضَرَتْ ﴿١٤﴾ فَلَآ اُقْسِمُ بِالْخُنَّسِ ﴿١٥﴾ اَلْجَوَارِ الْكُنَّسِ ﴿١٦﴾ وَالَّيْلِ اِذَا عَسْعَسَ
﴿١٧﴾ وَالصُّبْحِ اِذَا تَنَفَّسَ ﴿١٨﴾

---

göstərəcəyini izah etmək üçün əməllərin yazılı olduğu əməl dəftəri və onun insanlara verilməsi ifadəsini simvolik olaraq işlədir).

**11) (وَاِذَا السَّمَآءُ كُشِطَتْ) - Və o zaman ki, səma** (bizi əhatə edən hava) **yerindən qoparılıb fani olacaq, daha nə rütubət, nə də soyuqluq, nə də quruluq olmayıb, dünya qarma-qarışıq olacaq.**

**12) (وَاِذَا الْجَحِيمُ سُعِّرَتْ) - Və o zaman ki, cəhənnəm asilərdən ötrü şiddətlə alovlandırılacaq,**

**13) (وَاِذَا الْجَنَّةُ اُزْلِفَتْ) - Və o zaman ki, cənnət müttəqilərə yaxın olub, onların daxil olmaları üçün hazırlanacaq,**

**14) (عَلِمَتْ نَفْسٌ مَآ اَحْضَرَتْ)** (elə ki, qeyd olunan bu on üç hadisə vaqe olub, qiyamət qopar, o vaxt da hər kəs hazır etdiyi xeyir və şər əməllərə agah olub, hamısını açıq-aşkar görəcək, xeyir əməl sahibi sevinər, şər əməl sahibi isə təəssüf və peşmançılıq yaşayar. (Quranın Allah-Təaladan ruhani güc - Cəbrayıl vasitəsi ilə peyğəmbərə nazil olmasını Məkkəli Qüreyş əhli inkar edib, o cənaba dəli deyirdilər. Növbəti ayədə Qüreyşin bu sözləri “la” (xeyr) kəlməsi ilə rədd edilib, ondan sonra and içilməsi Quranın Cəbrayıl vasitəsi ilə Allah-Təaladan nazil olmasını və peyğəmbərin dəli olmamasını sübut edir, təfsirçilərin “la” kəlməsini növbəti ayədə artıq sayması məqbul deyil).

**15-16) (فَلَآ)** (Ey Məkkə əhli, Quranın bizim tərəfimizdən olmasını inkar etməniz və peyğəmbərimiz Məhəmmədə dəli deməniz batil iddiadır.

**(اُقْسِمُ بِالْخُنَّسِ اَلْجَوَارِ الْكُنَّسِ) And içirəm o planetlərə, o ulduzlara ki, hərəkət edərkən gah parlayıb, gah da geri qayıdıb, günəşin nuru səbəbi ilə gizlənərlər, (bu planetlər beş səyyarədən -Zöhrə** (Venera), **Ütarid** (Merkuri), **Mərrix** (Mars), **Zühal** (Saturn), **Müştəridən** (Yupiter) **ibarətdir. Bu planetlər seyr edərkən gah geri qayıdıb, seyrləri istiqamət üzrə olmadığından astronomlar onlara “çaşmış” deyirlər, günəşin nuru səbəbi ilə görünmədikləri üçün də onların bu halına “ulduzun günəşə yaxınlaşması” deyirlər. Hərçənd onların bəzisi günəşdən çox böyük və son dərəcə uzaqdır və Yupiter kimi günəş növündən olub günəşin hərarəti ona təsir edən deyildir, lakin bizim fikrimizə görə günəşin nuru səbəbi ilə görünmədikləri üçün onlara bu ad verilib. Bunlar digər ulduzlardan daha işıqlı və böyük olduqlarından Allah-Təala onlara and içir.**

**17) (وَالَّيْلِ اِذَا عَسْعَسَ) And olsun geri gedən gecəyə.**

**18) (وَالصُّبْحِ اِذَا تَنَفَّسَ) - Və and olsun sübh vaxtına, o zaman ki, nəfəs**

اِنَّهُ لَقَوْلُ رَسُولٍ كَرِيمٍۙ ﴿١٩﴾ ذِي قُوَّةٍ عِنْدَ ذِي الْعَرْشِ مَكِينٍۙ ﴿٢٠﴾ مُطَاعٍ ثَمَّ اَمِينٍۜ ﴿٢١﴾ وَمَا صَاحِبُكُمْ بِمَجْنُونٍۚ ﴿٢٢﴾ وَلَقَدْ رَاٰهُ بِالْاُفُقِ الْمُبِينِۚ ﴿٢٣﴾

---

**çəkib, nuru aydın olar,** (sübhün açılması ruhu canladırıb, qəm-qüssəni azaltdığından burada məcazən nəfəs çəkmək ifadəsi işləndi). **Əvvəlki ayələrdə and içəndən sonra and içilən şeyin nə olduğu növbəti ayədə bəyan edilir.**

**19) (**اِنَّهُ لَقَوْلُ رَسُولٍ كَرِيمٍۙ**) Həqiqətən, bu Quran bizim tərəfimizdən** (Məhəmmədə) **nazil olan əziz, möhtərəm elçinin** (Cəbrayılın) **sözüdür ki, bizim əmrimizlə** (Məhəmmədin) **qəlbinə nazil edibdir.** (Mələk və Cəbrayılın mənası bundan əvvəl qeyd olunubdur).

**20) (**ذِي قُوَّةٍ عِنْدَ ذِي الْعَرْشِ مَكِينٍۙ**)** (Cəbrayıl) **güclü elm sahibi olub, ərşin sahibi Allah-Təalanın yanında yaxın dərəcəyə, hörmətə malikdir.**

**21) (**مُطَاعٍ ثَمَّ اَمِينٍ**) - Cəbrayıl elm sahibi, hətta sırf elmdən ibarət olduğundan peyğəmbərlər tərəfindən ona itaət olunar, o, hər bir xətadan əmin-amandadır. Elmdən başqa nəyə itaət edilər və xətadan əmin-amanda olan başqa nə var?**

**22) (**وَمَا صَاحِبُكُمْ بِمَجْنُونٍۚ**) - Və yenə and içirəm əvvəl* qeyd olunan şeylərə ki, sizin bu sahibiniz** (Məhəmməd) **- hansı ki sizə peyğəmbər göndərmişəm, dəli deyildir. Siz ona dəli deməklə böyük xəta edirsiniz.**

**(*Qeyd:** *"Allah-Təalanın Qurani-Şərifdə bu şeylərə və bunlardan başqa bəzi əşyalara and içməsinin səbəbi ərəblərin onların həqiqətinə agah olmasa da, görünüşünə aldanıb, onları əziz və möhtərəm saymaları, ya da mənfəət əldə etmək istəmələridir. Bunlara and içmək ərəblərin son dərəcə cahil olduqlarına açıq-aşkar işarə edir. Çünki elm sahiblərinə bir məsələni dəlil üzrə isbat edərlər, amma cahillər dəlildən anlamadıqlarına görə, gərək and içərək onlara isbat olunsun. Qurani-Şərif Allah-Təaladan hikmət üzrə nazil olduğu içün elm sahiblərinə dəlil və sübut göstərilib, cahillərdən ötrü and içilməsi bir hikmətdir. Diqqət etmək lazımdır ki, zeytun və əncir ağacına, günəşə, aya, ya da ki, ulduzlara and içmənin səbəbi qeyd olunan bu hikmətdən başqa nə ola bilər? İslam dəvətçiləri də gərək Qurani-Şərifə tabe olub, ağıl sahiblərini dəlillə, cahilləri and içməklə dəvət etsinlər. Bədəvilər bəzən peyğəmbərin hüzuruna gəlib soruşardılar: "Allah-Təala tərəfindən gəlibsən"? Buyurardı: "Bəli". Bədəvi deyərdi: "Səni Allah-Təalaya and verirəm, sən bu sözündə sadiqsən?" Peyğəmbər deyərdi: "And olsun Allah-Təalaya, doğru deyirəm, mən peyğəmbərəm. Bədəvi bu anddan sonra imana daxil olardı").*

**23) (**وَلَقَدْ رَاٰهُ بِالْاُفُقِ الْمُبِينِۚ**) Həqiqətən,** (Məhəmməd) **Cəbrayılı** (elm ruhunu) **uca və əl-ayaq yetişməyən bir üfüqdə görüb, ondan elm öyrənməyə niyyət**

وَمَا هُوَ عَلَى الْغَيْبِ بِضَنِينٍ ﴿٢٤﴾ وَمَا هُوَ بِقَوْلِ شَيْطَانٍ رَجِيمٍ ﴿٢٥﴾ فَاَيْنَ تَذْهَبُونَ ﴿٢٦﴾ اِنْ هُوَ اِلَّا ذِكْرٌ لِلْعَالَمِينَ ﴿٢٧﴾ لِمَنْ شَٓاءَ مِنْكُمْ اَنْ يَسْتَقِيمَ ﴿٢٨﴾ وَمَا تَشَٓاؤُنَ اِلَّا اَنْ يَشَٓاءَ اللّٰهُ رَبُّ الْعَالَمِينَ ﴿٢٩﴾

---

**etdi. Biz də onun niyyətinə görə, onunla rəftar edib, Cəbrayılın ruhani gücü ilə onu əhatə edib, fəzilət və kamilliyini artırıb, öz tərəfimizdən onu siz insanlara peyğəmbər təyin etdik. İndi hansı elmi istəyirsinizsə, ondan soruşun.**

**24) (وَمَا هُوَ عَلَى الْغَيْبِ بِضَنِينٍ) - Belə olan halda** (Məhəmməd) **qeybi sizə xəbər verməkdə yalançı deyildir. Hər bir xəbərində sadiqdir. Bəs niyə ondan bunu qəbul etmirsiniz?**

**25) (وَمَا هُوَ بِقَوْلِ شَيْطَانٍ رَجِيمٍ) - Bu Quran bizim sözümüzdür. Bizim dərgahımızdan qovulan şeytanın sözü deyildir ki, onu qəbul etməyəsiniz.**

**26-27) (فَاَيْنَ تَذْهَبُونَ اِنْ هُوَ اِلَّا ذِكْرٌ لِلْعَالَمِينَ) Qurandan üz döndərib, hara gedirsiniz? Quran tövhidi əmr edir, siz tövhidi tərk edib, şirkə tabe olursunuz. Bu Quran, aləmlərdən ötrü ancaq öyüd-nəsihətdir.**

**28) (لِمَنْ شَٓاءَ مِنْكُمْ اَنْ يَسْتَقِيمَ) Quran sizlərdən elə şəxslər üçün öyüd-nəsihətdir ki, islama daxil olub düz yolla və ədalətlə rəftar etməyi özlərinə şüar edirlər, yoxsa inkarçılardan ötrü necə nəsihət ola bilər?**

**29) (وَمَا تَشَٓاؤُنَ اِلَّا اَنْ يَشَٓاءَ اللّٰهُ رَبُّ الْعَالَمِينَ) - Düz yolda və ədalətli olmanızı aləmlərə nizam verən rəbbiniz Allah-Təala özü istəməsə, siz istəyə bilməzsiniz, sizin haqqa meyl etməyinizə görə o, sizə yardım edər ki, islama daxil olub, düz yolu və ədaləti əldə edəsiniz.**

**Allaha həmd olsun, Təkvir surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: "Kim Təkvir surəsini oxusa, qiyamət günündə əməl dəftəri verilərkən, Allah-Təala o şəxsi rüsvay etməz.**

## əl-İNFİTAR SURƏSİ

82-ci surədir. Məkkədə nazil olub, 19 ayə, 580 kəlmə və 327 hərfdir.

**اِذَا السَّمَآءُ انْفَطَرَتْ ۙ﴿١﴾ وَاِذَا الْكَوَاكِبُ انْتَثَرَتْ ۙ﴿٢﴾ وَاِذَا الْبِحَارُ فُجِّرَتْ ۙ﴿٣﴾ وَاِذَا الْقُبُورُ بُعْثِرَتْ ۙ﴿٤﴾ عَلِمَتْ نَفْسٌ مَا قَدَّمَتْ وَاَخَّرَتْ ؕ﴿٥﴾ يَآ اَيُّهَا الْاِنْسَانُ مَا غَرَّكَ بِرَبِّكَ الْكَرِيمِ ۙ﴿٦﴾**

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (اِذَا السَّمَآءُ انْفَطَرَتْ) - O zaman ki qiyamət günündə səma** (bizi əhatə edən hava) **yarılıb, həyatın ünsürləri dəyişəcək,**

**2) (وَاِذَا الْكَوَاكِبُ انْتَثَرَتْ) - Və o zaman ki ulduzlar yerlərindən qopub, nurlarını itirib, yox olacaqlar,**

**3) (وَاِذَا الْبِحَارُ فُجِّرَتْ) - Və o zaman ki, dənizlərin hamısı bir-birinə qarışıb, bir dəniz olacaq,** (əvvəlki Təkvir surəsində dənizlərin quruması bundan sonra olacaq. Yer dəyişən zaman əvvəlcə dənizlər bir-birinə qarışıb bir dəniz olacaq, ondan sonra yerdə hərarət xeyli artdığından bütün dənizlər quruyacaq).

**4) (وَاِذَا الْقُبُورُ بُعْثِرَتْ) - Və o zaman ki, qəbirlər bizim əmrimizlə yerindən oynayıb, ölülər dirilib, oradan çıxacaq,**

**5) (عَلِمَتْ نَفْسٌ مَا قَدَّمَتْ وَاَخَّرَتْ) - Belə bir zamanda** (qiyamət günündə) **hər kəs daha əvvəl göndərdiyi hər bir xeyir əmələ, din və millət yolunda sərf etdiyi və varislərinə buraxdığı mallara agah olub, varisləri üçün saxladığı maldan ötrü təəssüf və peşmançılıq çəkər.**

**6) (يَآ اَيُّهَا الْاِنْسَانُ مَا غَرَّكَ بِرَبِّكَ الْكَرِيمِ ۙ) Ey insan, Allah-Təalanın mərhəməti və səxavəti sənə şamil olub, səni gözəl insan surətində yaradıb, sənə nemət verdiyi halda səni* nə məğrur edib, aldatdı ki, sənə verilən nemətlərə şükür etməyi tərk edib, Allah-Təalaya kafir olub, şərik qoşdun? Halbuki belə mərhəmətli, səxavətli Allah-Təalaya gərək şükür edəydin.**

**(*Qeyd:** "Allahın Rəsulu (ə.s) bu ayəni oxuyarkən deyərdi: "İlahi, insanı cəhaləti məğrur edib, aldatdı, o səbəbdən asi olub, nemətə qarşı küfr, nankorluq etdi. Ömər ibn Xəttab oxuyarkən deyərdi: "İlahi, insanı axmaqlıq və cəhaləti məğrur edib, aldatdı. Həsən əl-Bəsri oxuyarkən deyərdi: "İlahi, insanı şəri əmr edən xəbis nəfsi məğrur edib, aldatdı. Bu ayə bütün üzrxahlıqları rədd edib, kafir və asiləri lal və aciz etmək məqamında varid olubdur. Yəni o Allah-Təala ki, onun mərhəməti sizə şamil olub, vücud nemətindən əlavə hər bir növ nemətləri də sizə bəxş edir, belə Allah-Təalaya asi olmaq olarmı? Ayənin mənası budur.

اَلَّذٖي خَلَقَكَ فَسَوّٰيكَ فَعَدَلَكَۙ ﴿٧﴾ فٖيٓ اَيِّ صُورَةٍ مَا شَٓاءَ رَكَّبَكَۜ ﴿٨﴾ كَلَّا بَلْ تُكَذِّبُونَ بِالدّٖينِۙ ﴿٩﴾
وَاِنَّ عَلَيْكُمْ لَحَافِظٖينَۙ ﴿١٠﴾ كِرَامًا كَاتِبٖينَۙ ﴿١١﴾ يَعْلَمُونَ مَا تَفْعَلُونَ ﴿١٢﴾ اِنَّ الْاَبْرَارَ لَفٖي نَعٖيمٍۚ
﴿١٣﴾ وَاِنَّ الْفُجَّارَ لَفٖي جَحٖيمٍۚ ﴿١٤﴾ يَصْلَوْنَهَا يَوْمَ الدّٖينِ ﴿١٥﴾ وَمَا هُمْ عَنْهَا بِغَٓائِبٖينَۜ ﴿١٦﴾

---

Nəinki Həşəviyyə məzhəbinin dediyi kimi, guya Allah-Təala "Bi rabbikəl-kərim - Kərim, mərhəmətli Allah" deməklə qiyamətdə bəndələrinə cavab təlqin edir ki, bəndələr cavab verib desinlər: "İlahi, sənin mərhəmətin bizi məğrur edib, aldatdı. O səbəbdən sənə kafir və asi olduq. Belə olanda Allah qorusun, Allah-Təala özü bizi küfr və zındıqlığa vadar etmiş olar. Allah-Təala o zalımların dediklərindən pak və ucadır).

**7) (اَلَّذٖي خَلَقَكَ فَسَوّٰيكَ فَعَدَلَكَ) Allah-Təalanın sifətlərindən biri də odur ki, səni** (insanı) **yaradıb, sənə salamat üzvlər verib, yaradılışını mötədil və mütənasib edib, hamısını bir-birinə uyğun etdi. (فٖيٓ اَيِّ صُورَةٍ مَا شَٓاءَ رَكَّبَكَ) Gözəl və çirkin, uzun və qısa, qadın və kişi, bu müxtəlif surətlərin hansını Allah-Təala istəsə, ondan səni təşkil edib yaratdı.**

**10) (كَلَّا) - Məğrur olub, aldanıb, Allah-Təalanın mərhəmət və səxavətindən üz döndərdiniz. (بَلْ تُكَذِّبُونَ بِالدّٖينِۙ) Yox, Allah-Təalanın mərhəmətinə aldanmayıbsınız, əksinə haqq-hesab gününü təkzib edib, əməllərə cəza verməsini inkar edibsiniz.**

**11) (وَاِنَّ عَلَيْكُمْ لَحَافِظٖينَۙ كِرَامًا كَاتِبٖينَ) Sizə cəza verməsini inkar edibsiniz, amma bizim tərəfimizdən əziz, möhtərəm olan katiblər sizi gözətləyib, əməllərinizi qeyd edib, saxlayırlar.** (İnsanlar arasında hər bir şeyin hesabını qeyd etmək katibin işi olduğuna görə Allah-Təala da adətə görə bizim əməllərimizin qeyd edilib saxlanmasını katibə isnad edir. O, heç bir şeyə möhtac deyil).

**12) (يَعْلَمُونَ مَا تَفْعَلُونَ) - O katiblər sizin əməllərinizə agah olub, hamısını yadda saxlayarlar.**

**13) (اِنَّ الْاَبْرَارَ لَفٖي نَعٖيمٍۚ)** - (Ey Məhəmməd), **müşriklər əməllərə cəza verilməsini inkar edirlər, halbuki həqiqətən, gözəl əməl sahibləri həmişəlik cənnət nemətlərinin içində olacaqlar.**

**14) (وَاِنَّ الْفُجَّارَ لَفٖي جَحٖيمٍۚ) - Və həqiqətən, günahkarlar əlbəttə cəhənnəm əzabının içində olacaqlar.**

**15) (يَصْلَوْنَهَا يَوْمَ الدّٖينِ) - İnkar etdikləri cəza** (qiyamət) **günündə cəhənnəmə daxil olacaqdır.**

**16) (وَمَا هُمْ عَنْهَا بِغَٓائِبٖينَ) Asilər heç vaxt cəhənnəmdən qeyb olmayıb, əzabdan xilas olmayacaqlar.**

وَمَٓا اَدْرٰيكَ مَا يَوْمُ الدِّينِۙ ﴿١٧﴾ ثُمَّ مَٓا اَدْرٰيكَ مَا يَوْمُ الدِّينِۜ ﴿١٨﴾ يَوْمَ لَا تَمْلِكُ نَفْسٌ لِنَفْسٍ شَيْـًٔاۜ وَالْاَمْرُ يَوْمَئِذٍ لِلّٰهِ ﴿١٩﴾

---

**17-18) (وَمَٓا اَدْرٰيكَ مَا يَوْمُ الدِّينِۙ ثُمَّ مَٓا اَدْرٰيكَ مَا يَوْمُ الدِّينِۜ)** - (Ey Məhəmməd), **cəza gününün dəhşət və şiddətini sənə nə bildirib?** (İki dəfə) **Əlbəttə, heç bir şey bildirilməyib. Gərək biz sənə bildirək.** (Cəza gününün əzabı təsəvvürlərin üstündə olub, insanların dərk etmə gücünün üstündə olduğuna görə ayə təkrar edildi).

**19) (يَوْمَ لَا تَمْلِكُ نَفْسٌ لِنَفْسٍ شَيْـًٔاۜ) - Cəza günü elə bir gündür ki, o gün heç kim başqa birinin əzabını dəf edib, fayda vermək üçün bir şeyə malik olmaz.**

**(وَالْاَمْرُ يَوْمَئِذٍ لِلّٰهِ) - Ogünkü gündə hökm Allah-Təalaya məxsusdur. Yalnız özü hökm edər, onun hökmünə şərik olan olmaz.**

Allaha həmd olsun, əl-İnfitar surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu buyurdu: “Kim əl-İnfitar surəsini oxusa, Allah-Təala ondan ötrü savab yazar.

# əl-MÜTƏFFİFİN SURƏSİ

83-cu surədir. Mədinədə nazil olub, 36 ayə, 169 kəlmə və 730 hərfdir.

وَيْلٌ لِلْمُطَفِّفِينَ ﴿١﴾ اَلَّذِينَ اِذَا اكْتَالُوا عَلَى النَّاسِ يَسْتَوْفُونَ ﴿٢﴾

**Bismillahir-Rəhmanir-Rəhim**

Mədinə əhlinin alış-verişi ölçü və çəki ilə olardı. Lakin böyük ölçü və çəki ilə alıb, kiçik ölçü və çəki ilə satardılar. Peyğəmbər (ə.s) Mədinəyə hicrət edəndən sonra bu surə nazil oldu. Peyğəmbər (ə.s) camaatın arasına çıxıb, bu surəni oxudu. Ondan sonra buyurdu: "İnsanın etdiyi beş xəbis əməlin müqabilində beş bəla nazil olar. Soruşdular: "Ey peyğəmbər, o beş xəbis əməl və onların müqabilində gələn o beş bəla nədir? Buyurdu: 1- hansı camaat ki, verdiyi sözü pozub, əhdinə sadiq olmadı, Allah-Təala düşmənlərini onlara hakim edər.* 2- hansı camaat ki, Allah-Təalanın hökmünə zidd hökm verər, (biz müsəlmanlar kimi) onların arasında yoxsulluq zühur edər. 3- hansı camaat ki, onların içində günah meydana gəlib, çoxalar, (biz müsəlmanlar kimi), ölüm onların arasında yayılıb, çox ölərlər. 4- hansı camaat ki, çəkidə və ölçüdə xəyanət edər, yerdə ot göyərməyib, qıtlığa düçar olarlar. 5- hansı camaat ki, zəkatı tərk edər, yağışdan məhrum olarlar. (Bundan sonra surənin təfsiri başlayır).

**1) (وَيْلٌ لِلْمُطَفِّفِينَ)** - (Ey Məhəmməd), **alış-verişdə insanların haqqını əskildib, azaldanlara əzab olsun.**

**2) (اَلَّذِينَ اِذَا اكْتَالُوا عَلَى النَّاسِ يَسْتَوْفُونَ) Haqqı azaldanlar o şəxslərdir ki, xalqdan ölçü və ya çəki ilə bir şey alanda, artıq və çox alar, insanlara zərər verərlər.**

**(*Qeyd:** *"Əhdi pozmanın ən böyük nümunəsi tövhiddən imtina edib, gizli və ya açıq şirki seçib, ağılla hərəkət etməməkdən ibarətdir. Uca peyğəmbərimizin mübarək kəlamları tamamilə bizim dövrümüzü izah edən xəbərlərdir. Xaricilərin müsəlmanlara hakim olmalarının səbəbi müsəlmanların həmin əhdi pozub, islamın ehkamına əməl etməmələri deyilmi? Və yenə yoxsulluq deyərkən ilk öncə ağıla var-dövlətdən məhrumluq gəlir, lakin o cənabın mübarək kəlmələrinin batini mənasına baxdıqda başqa bir yoxsulluq, yəni elm yoxsulluğunun nəzərdə tutulduğu məlum olur. (Allahın Rəsulu ə.s. doğru deyir). Bizim bu dövrdə elmə olan ehtiyacımız və elmi məhrumiyyətimiz indiyə qədər heç bir dövrdə olmayıb. Bunun səbəbi Qurani-Şərifə zidd hökmlərin bizim aramızda rəvac tapma-*

وَاِذَا كَالُوهُمْ اَوْ وَزَنُوهُمْ يُخْسِرُونَ ﴿٣﴾ اَلَا يَظُنُّ اُولٰٓئِكَ اَنَّهُمْ مَبْعُوثُونَ ﴿٤﴾ لِيَوْمٍ عَظِيمٍ ﴿٥﴾

---

*sıdır, yoxsa Qurani-Şərifin ehkamını və onun ehtiva etdiyi məlumatları və elmi öyrənməyə və əməl etməyə can atıb, hər bir elmə agah olub, belə yoxsulluğa düçar olmazdıq. Elmsizlik və cəhalətin səbəbi ancaq Qurani-Şərifin ehkamından üz döndərməmizdir və yenə müsəlmanların arasında günahların yayılması da ölümlərin artmasına səbəb olur. Günəş kimi parlaq olan uca peyğəmbərimizin kəlamlarında böyük faydalar və öyüd-nəsihətlər vardır. Yəni günahlara dalmaq müxtəlif xəstəliklərin meydana çıxmasına və ölümə səbəb olub, onları məhv edər. Necə ki, bu mətləb günahkarların arasında müşahidə olunur. Cavan şəxslər ömürlərinin başlanğıcında və bədənləri sağlam olarkən şəri əmr edən xəbis nəfsə tabe olub, günahlara dalmaqla ömürlərini puç edib, heç bir xeyir qazanmamış, ölümlə qucaqlaşıb, dünyadan gedərlər. Ümmət dərdi çəkən uca peyğəmbərimizin dünya və axirət faydasını göstərən mübarək kəlmələrinə qulaq asmamaq və itaət etməmək ancaq nadanlıq əlamətidir. Habelə ölçüdə, çəkidə, alış-verişdə xəyanət etməyin ruzinin azalmasına və qıtlığa səbəb olması açıq-aşkar bilinən işlərdir. Hansı xalqın arasında bu kimi xəyanətlər rəvac tapsa, məişətləri çətinləşər, zillət və həqirliklə güzəran keçirib, axırda da boş əllə dünyadan gedib, dəfn, kəfən pulu üçün də başqalarına möhtac qalarlar. Ən böyük xəyanət zəkatı tərk etməkdir. Yağışın yağmamasına, xeyir və mənfəətin qəhətliyinə, şər və zərərə düçar olmağa səbəb olar. Zəkatı verməyənlərin mallarının çox olmasına aldanma. Xeyir və bərəkətin olmaması təkcə yoxsullaşmaqdan ibarət deyildir. Varlı olan şəxslər çox vaxt dünyada öz mallarının xeyrini görməyib, qəm və qüssə içində yaşayarlar. (Necə ki, müsəlmanların varlıları). Belə şəxslər xeyir və mənfəət qıtlığına düşüb, şər və zərərə düçar olarlar. Dayaz fikirlilərin nəzərində dünya malı xeyir və mənfəət kimi görünsə də, əslində ondan böyük şər və zərər yoxdur. Bir mal ki, ondan Allah-Təalanın əmr etdiyi zəkat verilməyib və millətə bir fayda gəlməyib, daş-torpaq ondan yaxşıdır, belə malı saxlamaq muzdsuz hamballıq etmək, qorxu və zəlalətdən başqa bir şeyə səbəb olmaz. Həqiqətən, zəkat verməyən şəxs həmişə xeyir və mənfəətə möhtac, həmişə şər və zərərdə olub, Allah-Təalanın əzabından nicat tapmayacaqdır. Allah-Təalanın ayələrini və peyğəmbərin möcüzəli kəlamlarını bu şəkildə anlayıb, onların həqiqi mənalarını dərk etmək lazımdır. Allah müvəffəq edən və xeyirdə yardımçı olandır).*

**3) (وَاِذَا كَالُوهُمْ اَوْ وَزَنُوهُمْ يُخْسِرُونَ) Amma xalqa satmaq üçün ölçəndə və ya çəkəndə əskik və az edib, elə satarlar.**

**4-5) (اَلَا يَظُنُّ اُولٰٓئِكَ اَنَّهُمْ مَبْعُوثُونَ لِيَوْمٍ عَظِيمٍ)** - (Ey Məhəmməd), **alış-verişdə nöqsan edənlər bəs fikirləşmirlər ki, həqiqətən, onlar böyük bir gündən ötrü** (qiyamət günündən ötrü) **diriləcəklər? Belə ki, belə qəbih əməli tərk etsinlər. Hərçənd onlar qiyamətin vaqe olacağına etiqad etmirlər, lakin**

يَوْمَ يَقُومُ النَّاسُ لِرَبِّ الْعَالَمٖينَۜ ﴿٦﴾ كَلَّٓا اِنَّ كِتَابَ الْفُجَّارِ لَفٖي سِجّٖينٍۜ ﴿٧﴾ وَمَٓا اَدْرٰيكَ مَا سِجّٖينٌۜ
﴿٨﴾ كِتَابٌ مَرْقُومٌۜ ﴿٩﴾ وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبٖينَۙ ﴿١٠﴾ اَلَّذٖينَ يُكَذِّبُونَ بِيَوْمِ الدّٖينِۜ ﴿١١﴾ وَمَا
يُكَذِّبُ بِهٖٓ اِلَّا كُلُّ مُعْتَدٍ اَثٖيمٍۙ ﴿١٢﴾ اِذَا تُتْلٰى عَلَيْهِ اٰيَاتُنَا قَالَ اَسَاطٖيرُ الْاَوَّلٖينَۜ ﴿١٣﴾ كَلَّا بَلْ رَانَ
عَلٰى قُلُوبِهِمْ مَا كَانُوا يَكْسِبُونَ ﴿١٤﴾

---

**əlbəttə qiyamət vaqe olub, ogünkü gündə onların belə qəbih və xəbis əməllərinin cəzası onlara veriləcəkdir.**

**6) (يَوْمَ يَقُومُ النَّاسُ لِرَبِّ الْعَالَمٖينَ) Elə bir gündə diriləcəklər ki, o gün insanların hamısı aləmlərin tərbiyə verən rəbbi Allah-Təalanın əmr və iradəsindən ötrü qəbirlərindən qalxıb, hesab vermək üçün məhşərə varid olacaqlar.**

**7) (كَلَّٓا)** - (Ey Məhəmməd), **əlbəttə, gərək alış-verişdə əskiltməyi tərk edib, qiyamət günündə Allah-Təalanın hüzuruna hazır olub, hesab verəcəklərindən qafil olmasınlar. (اِنَّ كِتَابَ الْفُجَّارِ لَفٖي سِجّٖينٍ) - İnsanlar elə xəyal etməsin ki, Allah-Təala onların əməllərindən qafildir. Həqiqətən, fasiq və günahkarların əməllərinin yazılıb, qeyd olunduğu səhifələrin hamısı onlardan ötrü təyin edilən bir kitabda toplanıb, heç vaxt məhv olmayacaqdır.**

**8) (وَمَٓا اَدْرٰيكَ مَا سِجّٖينٌ)** - (Ey Məhəmməd), **"siccin"in nə olduğunu sən nə bilirsən? Heç bir şey sənə bildirilməyib, gərək biz sənə bildirək.**

**9) (كِتَابٌ مَرْقُومٌ) "Siccin" bir kitabdır. Kafir və fasiqlərin əməllərindən ötrü nişanlanıb, hamısının əməlləri həmin kitabda toplanıb, yazılacaqdır.**

**10) (وَيْلٌ يَوْمَئِذٍ لِلْمُكَذِّبٖينَ) Kitabların meydana çıxdığı haqq-hesab günündə** (qiyamət günündə) **o günü təkzib edənlərə əzab olsun.** (Yəni əlbəttə onlara əzab olunacaqdır).

**11) (اَلَّذٖينَ يُكَذِّبُونَ بِيَوْمِ الدّٖينِ) Fasiq və günahkarlar cəza gününü təkzib edən şəxslərdir. Əlbəttə, o gün onlara cəza verilib, əzab olunacaqlar.**

**12) (وَمَا يُكَذِّبُ بِهٖٓ اِلَّا كُلُّ مُعْتَدٍ اَثٖيمٍ) Haqq və ədaləti tanımayan, həddi aşıb, günaha dalandan başqası haqq-hesab gününü təkzib etməz.**

**13) (اِذَا تُتْلٰى عَلَيْهِ اٰيَاتُنَا قَالَ اَسَاطٖيرُ الْاَوَّلٖينَ)** - (Ey Məhəmməd), **haqq-hesab gününü** (qiyaməti) **inkar edən şəxsə bizim ayələrimiz** (Quranımız) **oxunanda, qəbul etməyib deyər: "Bu sözlər keçənlərin yalan və batil sözləridir. Bu sözləri biz qəbul edən deyilik.**

**14) (كَلَّٓا) - Əlbəttə, gərək haqq-hesab və cəza gününü təkzib etməyib, özlərini fəlakətə salmasınlar. (بَلْ رَانَ عَلٰى قُلُوبِهِمْ مَا كَانُوا يَكْسِبُونَ)** - (Ey Məhəmməd), **bəlkə də qazandıqları xəbis əməllər onlara qalib gəlib, qəlblərini bağla-**

كَلَّا اِنَّهُمْ عَنْ رَبِّهِمْ يَوْمَئِذٍ لَمَحْجُوبُونَ ﴿١٥﴾ ثُمَّ اِنَّهُمْ لَصَالُوا الْجَحِيمِ ﴿١٦﴾ ثُمَّ يُقَالُ هٰذَا الَّذِي
كُنْتُمْ بِهِ تُكَذِّبُونَ ﴿١٧﴾ كَلَّا اِنَّ كِتَابَ الْاَبْرَارِ لَفِي عِلِّيِّينَ ﴿١٨﴾ وَمَآ اَدْرٰيكَ مَا عِلِّيُّونَ ﴿١٩﴾ كِتَابٌ
مَرْقُومٌ ﴿٢٠﴾ يَشْهَدُهُ الْمُقَرَّبُونَ ﴿٢١﴾ اِنَّ الْاَبْرَارَ لَفِي نَعِيمٍ ﴿٢٢﴾ عَلَى الْاَرَآئِكِ يَنْظُرُونَ ﴿٢٣﴾

---

**mışdır və bu səbəbdən haqqı dərk etməyib, haqq-hesab və cəza gününü inkar edirlər.**

**15) (كَلَّا) - Əlbəttə, gərək onlar qəlblərini örtən xəbis əməllər etməkdən imtina və tövbə edib, qəlblərini saflaşdırsınlar. Ta ki, qəlbləri kinküdurətdən pak olub, haqqı qəbul etməyə layiq olsun.**

**(اِنَّهُمْ عَنْ رَبِّهِمْ يَوْمَئِذٍ لَمَحْجُوبُونَ) Həqiqətən, belə şəxslər öz xəbis əməllərinə görə qəlblərinin bağlanması səbəbi ilə qiyamət günündə tərbiyə verən Allah-Təalanın ilahi rəhmətindən və lütfündən məhrum olacaqlar.**

**16) (ثُمَّ اِنَّهُمْ لَصَالُوا الْجَحِيمِ) Allah-Təalanın rəhmətindən mərhum olandan sonra həqiqətən, onlar əzabdan ötrü cəhənnəmə daxil olacaqlar.**

**17) (ثُمَّ يُقَالُ هٰذَا الَّذِي كُنْتُمْ بِهِ تُكَذِّبُونَ) - Cəhənnəmə daxil olandan sonra onlara deyilər: "Bu əzab həmin əzabdır ki, dünyada bizim peyğəmbərlərimiz sizə xəbər verəndə təkzib edib, inkar edirdiniz.**

**İndi onların sözləri haqq oldumu? Həmişəlik əzab içində olub, nicat tapmayacaqsınız.**

**18) (كَلَّا) - Əlbəttə, gərək peyğəmbərlərin əzab barədəki xəbərlərini təkzib etməyib, təsdiq edib, gözəl əməllər etsinlər. (اِنَّ كِتَابَ الْاَبْرَارِ لَفِي عِلِّيِّينَ)** - (Ey Məhəmməd), **həqiqətən, gözəl əməl sahiblərinin əməllərinin yazılıb, qeyd olunduğu səhifələrinin hamısı onlardan ötrü təyin edilən bir kitabda toplanıb qorunacaqdır.**

**19) (وَمَآ اَدْرٰيكَ مَا عِلِّيُّونَ)** - (Ey Məhəmməd), **"عِلِّيُّونَ"un nə olduğunu sən nə bilirsən? Sənə heç bir şey bildirilməyib. Gərək biz sənə bildirək.**

**20) (كِتَابٌ مَرْقُومٌ) (İlliyyun) bir kitabdır ki, bütün möminlərin əməllərindən ötrü nişanlanıb, hamısının əməlləri toplanıb o kitabda yazılacaqdır.**

**21) (يَشْهَدُهُ الْمُقَرَّبُونَ) Allah-Təalaya yaxın olanlar** (peyğəmbərlər) **o kitablarda qeyd olunan əməllərin doğruluğuna şəhadət edərlər.**

**22) (اِنَّ الْاَبْرَارَ لَفِي نَعِيمٍ)** - (Ey Məhəmməd), **həqiqətən, gözəl əməl sahibləri həmişə cənnət nemətləri içində olub, rahat olarlar.**

**23) (عَلَى الْاَرَآئِكِ يَنْظُرُونَ) Taxtlar üstündə əyləşib, Allah-Təalanın bəxş etdiyi nemətlərə baxıb, ləzzət alarlar.**

تَعْرِفُ فِي وُجُوهِهِمْ نَضْرَةَ النَّعِيمِ ﴿٢٤﴾ يُسْقَوْنَ مِنْ رَحِيقٍ مَخْتُومٍ ﴿٢٥﴾ خِتَامُهُ مِسْكٌ وَفِي ذٰلِكَ
فَلْيَتَنَافَسِ الْمُتَنَافِسُونَ ﴿٢٦﴾ وَمِزَاجُهُ مِنْ تَسْنِيمٍ ﴿٢٧﴾ عَيْنًا يَشْرَبُ بِهَا الْمُقَرَّبُونَ ﴿٢٨﴾ اِنَّ
الَّذِينَ اَجْرَمُوا كَانُوا مِنَ الَّذِينَ اٰمَنُوا يَضْحَكُونَ ﴿٢٩﴾

---

**24)** (تَعْرِفُ فِي وُجُوهِهِمْ نَضْرَةَ النَّعِيمِ) - (Ey Məhəmməd), **əgər cənnət əhlinin üzlərinə baxsan, hər halda onların üzlərində nemətin təzəliyini görüb, cənnət əhli olmalarına agah olarsan.** (Necə ki, dünyada varlıların surətlərindən varlı olduqları məlum olur).

**25)** (يُسْقَوْنَ مِنْ رَحِيقٍ مَخْتُومٍ) **Saf və xalis, ağla zərər verməyən, qabının ağzı bizim qüdrətimizlə bağlanıb, möhür vurulan şərabdan cənnət əhlinə içizdirərlər.**

**26)** (خِتَامُهُ مِسْكٌ) **Şərab qabının ağzı müşk ilə möhürlənib, ta ki, onu açan zaman onun gözəl ətri yayılar, cənnət əhlinin qoxlama duyğusu dad alma duyğusundan əvvəl ləzzət və həzz alar.** (وَفِي ذٰلِكَ فَلْيَتَنَافَسِ الْمُتَنَافِسُونَ) **Yarışanlar gərək belə nemətləri əldə etmək üçün həvəslə yarışsınlar. (Allah-Təalaya itaət etməyə yönəlib, asi olmaqdan çəkinsinlər).**

**27)** (وَمِزَاجُهُ مِنْ تَسْنِيمٍ) - **Bütün cənnət əhlinin içdiyi şərablardan daha əla və üstün olan bir şərabdan onların şərabına qarışdırılar. (Necə ki, dünyada içilən şərbətlərə bəzi ətirli şeylər qarışdırılar).**

**28)** (عَيْنًا يَشْرَبُ بِهَا الْمُقَرَّبُونَ) **O əla şərab cənnətdə elə bir çeşmədir ki, ondan bütün cənnət əhlinin şərabına ətir vermək üçün qarışdırılar, lakin ilahi dərgaha yaxın olan bəndələr heç bir qarışığı olmayan o xalis çeşmədən içərlər.** *(Ayədə cənnət üçün vəd edilən müxtəlif nemətlərin və içəcəklərin qeyd edilməsinin məqsədi biz müsəlmanları maarif və insanlığa sövq edib, vəhşilik və cəhalətdən qortarmaqdır. Qurani-Şərifdə Allah gah qorxutmaq, gah da müjdələmək yolu ilə bizi elm və maarifə cəlb etməyə çalışır. Heyf ki, nə həqiqəti görən göz, nə həqiqəti eşidən qulaq, nə də həqiqəti anlayan bir qəlb bizdə yoxdur. Ta ki, ayələrinin məqsədini anlayıb, dünya və axirətdə qurtuluşa nail olaq, lakin biz, adımızı Quran əhli qoyub, lakin onun əsl məqsədini anlamayıb, bəyan edənin sözünə də baxmayıb, hətta təkfir edib, ayələrin məqsədinin sadəcə yemək-içmək, qara gözlü hurilərlə gündə yüz min dəfə əlaqədə olmaq zənn edib, bunlarla şad olub, ömrümüzü qəflətdə keçirib, cəhalət xəstəliyinə düçar olmuşuq. Bu cəhalətə səbəb olub, müsəlmanları cahil edənlər Allah-Təala yox edib, onların əvəzinə müsəlmanların din və dünya işlərini anlayan şəxsləri onlara rəhbər etsin! Amin!)*

**29)** (اِنَّ الَّذِينَ اَجْرَمُوا كَانُوا مِنَ الَّذِينَ اٰمَنُوا يَضْحَكُونَ) - (Ey Məhəmməd), **həqiqətən, kafir və müşriklər möminlərə istehza edib gülürlər.**

وَاِذَا مَرُّوا بِهِمْ يَتَغَامَزُونَۘ ﴿٣٠﴾ وَاِذَا انْقَلَبُوٓا اِلٰٓى اَهْلِهِمُ انْقَلَبُوا فَكِهِينَۘ ﴿٣١﴾ وَاِذَا رَاَوْهُمْ قَالُوٓا
اِنَّ هٰٓؤُلَٓاءِ لَضَٓالُّونَۙ ﴿٣٢﴾ وَمَٓا اُرْسِلُوا عَلَيْهِمْ حَافِظِينَۜ ﴿٣٣﴾ فَالْيَوْمَ الَّذِينَ اٰمَنُوا مِنَ الْكُفَّارِ
يَضْحَكُونَۙ ﴿٣٤﴾ عَلَى الْاَرَٓائِكِۙ يَنْظُرُونَۜ ﴿٣٥﴾

---

**30)** (وَاِذَا مَرُّوا بِهِمْ يَتَغَامَزُونَ) **- O zaman ki, möminlər kafir və müşriklərin məclislərinə keçdilər,** (kafirlər) **onlara baxıb, bir-birilərinə gözlə işarə edib, istehza edərlər.**

**31)** (وَاِذَا انْقَلَبُوٓا اِلٰٓى اَهْلِهِمُ انْقَلَبُوا فَكِهِينَ) **- Möminlərə istehza edən kafirlər nə zaman ki, öz evlərinə, ailələrinin yanına qayıtdılar, əməllərindən ləzzət aldıqları halda qayıdıb, şadyanalıq edərlər.**

**32)** (وَاِذَا رَاَوْهُمْ قَالُوٓا اِنَّ هٰٓؤُلَٓاءِ لَضَٓالُّونَ) **Kafirlər möminləri görəndə bir-birilərinə deyərlər: "Bunlara baxın, bunlar özlərini həqiqət və hidayətdə zənn edirlər, halbuki həqiqətən, bunlar** (Məhəmmədə) **tabe olub, onun xəyallarına bağlanmaqla zəlalət içində olub, haqdan uzaq düşüblər.**

**33)** (وَمَٓا اُرْسِلُوا عَلَيْهِمْ حَافِظِينَ) - (Ey Məhəmməd), **kafirlər möminlərin hər bir əhvallarına və əməllərinə və necə dolanmalarına vəkil və gözətçi göndərilməyiblər. Onlar heç vaxt möminlərin hallarını gözətləməsinlər, gərək bundan çəkinsinlər.**

**34)** (فَالْيَوْمَ الَّذِينَ اٰمَنُوا مِنَ الْكُفَّارِ يَضْحَكُونَ) - (Ey Məhəmməd), **müəyyən bir gündə** (qiyamət günü) **möminlər kafirlərə güləcəklər.**

**35)** (عَلَى الْاَرَٓائِكِۙ يَنْظُرُونَۜ) **- Möminlər taxt üstündə olan halda kafirlər onlara baxıb, təəssüf və peşmanlıq çəkib, dünyada etdikləri istehzaya peşman olarlar.** *(Təfsirçilər bu müəyyən günü qiyamət sayıb, möminlərin cənnətdə taxt üstündə olan halda kafirlərin halına agah olub, onlara gülüb, kafirlərin də onlara baxıb peşman olacağını deyiblər. Mən həqir də təfsirçilərə tabe olub, elə məna verdim. Lakin təfsirçilər məsələnin həqiqətindən qafil olub, ayədə axirətdən bəhs edildiyini zənn ediblər. Çünki axirət mənasını vermək ağla ilk gələn və təfsirçilərdən ötrü ən asan və sadə bir yoldur. Amma ayəyə bu dünyada müsəlmanların qələbə çalıb, hakim olması, kafir və müşriklərin onlara tabe və zəlil olması mənasını verməkdən nə zərər gələr? Ayənin əsl məqsədi bu mənadır, nəinki axirət mənası. Bu da bizim uca peyğəmbərimizin bir möcüzəsidir ki, müsəlmanların qalib və hakim olacağını xəbər verib və o xəbər doğru çıxıbdır. Buna görə ayənin mənası belədir: (Ey Məhəmməd), hərçənd indi, sizin bu zəlil halınızda kafirlər sizə gəlib istehza edirlər, amma bir gün olacaqdır ki, siz kafirlərə qalib olub, onlara gülüb, istehza edəcəksiniz. Kafirlər əbədi olaraq zəlil kimi sizin hüzurunuzda durub, hakimiyyətinizə baxıb, təəssüf edib, etdikləri əməllərə peşman olacaqlar. Ayənin əsl məqsədi bu mənadır. Bu məna həm islamın haqq olmasına və həm peyğəmbərin doğrulu-*

هَلْ ثُوِّبَ الْكُفَّارُ مَا كَانُوا يَفْعَلُونَ ﴿٣٦﴾

---

*ğuna, həm də Qurani-Şərifin möcüzə olmasına dəlil olan bir mənadır. Ayənin bu mənasını tərk edib, axirət mənasını verməyin nə faydası var? Həqiqət bu mənadır ki, qeyd etdim. Hər iki mənanı da qeyd etməyim ağıl sahiblərinin anlaması üçündür. Allah azğınlara qarşı özündən yardım istənəndir).*

**36) (هَلْ ثُوِّبَ الْكُفَّارُ مَا كَانُوا يَفْعَلُونَ) - Bəs kafirlərin möminlərə etdikləri əməllərinin cəzası onlara verildimi? Əlbəttə, verildi. Allah-Təalanın qulu doğru olub, möminlər kafirlərə qalib oldular. Möminlər hakimiyyətə nail olub, bütün müşriklər də onlara tabe oldular.** (Bu surə Mədinədə gəldiyindən bu ayələrin nazil olması möminlərin kafirlərə qalib olmasından sonra olubdur. Doğrusunu Allah bilir).

Allaha həmd olsun, əl-Mütəffifin surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim əl-Mütəffifin surəsini oxusa, Allah-Təala qiyamət günündə ağızı möhürlü olan bu şərabdan ona içizdirər."*

## əl-İNŞİQAQ SURƏSİ

84-cu surədir. Məkkədə nazil olub, 25 ayə, 107 kəlmə və 430 hərfdir.

اِذَا السَّمَٓاءُ انْشَقَّتْۙ ﴿١﴾ وَاَذِنَتْ لِرَبِّهَا وَحُقَّتْۙ ﴿٢﴾ وَاِذَا الْاَرْضُ مُدَّتْۙ ﴿٣﴾ وَاَلْقَتْ مَا فِيهَا وَتَخَلَّتْۙ ﴿٤﴾ وَاَذِنَتْ لِرَبِّهَا وَحُقَّتْۜ ﴿٥﴾ يَٓا اَيُّهَا الْاِنْسَانُ اِنَّكَ كَادِحٌ اِلٰى رَبِّكَ كَدْحًا فَمُلَاقِيهِۚ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (اِذَا السَّمَٓاءُ انْشَقَّتْۙ) - O zaman ki, səma (bizi əhatə edən hava) yarılıb, bir-birindən aralanıb, ünsürləri parçalanıb, məhv olacaq, (o vaxt insanın yaşaması mümkün olmayıb, hamısı həlak olar).**

**2) (وَاَذِنَتْ لِرَبِّهَا وَحُقَّتْۙ) Səma* öz mürəbbisi, rəbbi Allah-Təalaya** (eşidən və ağıllı şəxslər kimi) **yarılmaqda itaət edər və bu itaət etmək əlbəttə, səmaya layiqdir. Allah-Təalanın məxluqu olması səbəbi ilə gərək itaət etsin.**

**3-4) (وَاِذَا الْاَرْضُ مُدَّتْۙ وَاَلْقَتْ مَا فِيهَا وَتَخَلَّتْۙ)** - (Ey Məhəmməd), **o zaman ki, bizim əmrimizlə dağlar pozulub, dərələr dolub, düz və hamar bir yer olacaq, o vaxt içindəki bütün ölüləri və digər xəzinə və mədənlərini atıb, quru yer hər bir şeydən xali qalar.**

**(*Qeyd:** *"Hər bir şəxsin yaradılmasını xalis şüursuz havaya, təbiətə isnad edən, Allahı inkar edən materialistlərin qəlblərinə bu ayə meteor, axan ulduz kimi çarpır. Çünki ayəyə görə havanın, təbiətin də bir mürəbbisi, rəbbi olduğuna görə, hava, təbiət özü müstəqil yaradıcı ola bilməz. Bəli, yeganə olan yaradıcı hər bir şeyi səbəbi ilə birlikdə yaradıb, bir-birinə bağlı edib. Havanın, təbiətin də ünsürləri nə zamansa pozulacaq, Allah aləmi yox edəcək. Quran əhli gərək etiqadını Qurani-Şərifdən alıb, başqa din və millətlərin mənasız xurafatlarına qulaq asmayıb, şüursuz olan havanı, təbiəti şüur sahibi, elm, idrak və iradə sahibi insanın yaradıcısı saymasınlar. Ar olsun materialistlərə).*

**5) (وَاَذِنَتْ لِرَبِّهَا وَحُقَّتْۜ) Yer öz rəbbi, mürəbbisi Allah-Təalaya** (eşidən və ağıllı şəxs kimi) **düz olub, içində olan hər bir şeyi atıb, göstərməklə itaət edər və bu itaət etmək yerə layiqdir. Allah-Təalanın məxluqu olması səbəbi ilə gərək itaət etsin. O zaman ki, belə işlər vaqe olar, o vaxt qiyamət qopub, hər kəs öz əməlinə agah olacaqdır.**

**6) (يَٓا اَيُّهَا الْاِنْسَانُ اِنَّكَ كَادِحٌ اِلٰى رَبِّكَ كَدْحًا فَمُلَاقِيهِۚ) Ey insan, həqiqətən, sən hər bir xeyir və ya şər əmələ ki, yönəlib, hansı əməl üçün cidd-cəhd edib, çalışırsansa, o halda da ölüb, rəbbin Allah-Təalanın hüzuruna yetişib, elə o əməllə də qarşılaşarsan.**

فَاَمَّا مَنْ اُوتِيَ كِتَابَهُ بِيَمِينِهٖۙ ﴿٧﴾ فَسَوْفَ يُحَاسَبُ حِسَابًا يَسِيرًاۙ ﴿٨﴾ وَيَنْقَلِبُ اِلٰى اَهْلِهٖ مَسْرُورًاۜ
﴿٩﴾ وَاَمَّا مَنْ اُوتِيَ كِتَابَهُ وَرَاۤءَ ظَهْرِهٖۙ ﴿١٠﴾ فَسَوْفَ يَدْعُو ثُبُورًاۙ ﴿١١﴾ وَيَصْلٰى سَعِيرًاۜ ﴿١٢﴾
اِنَّهُ كَانَ فٖى اَهْلِهٖ مَسْرُورًا ﴿١٣﴾ اِنَّهُ ظَنَّ اَنْ لَنْ يَحُورَۚ ﴿١٤﴾ بَلٰىۚ اِنَّ رَبَّهُ كَانَ بِهٖ بَصِيرًاۜ﴿١٥﴾
فَلَاۤ اُقْسِمُ بِالشَّفَقِۙ﴿١٦﴾

---

**7-8) (فَاَمَّا مَنْ اُوتِيَ كِتَابَهُ بِيَمِينِهٖۙ فَسَوْفَ يُحَاسَبُ حِسَابًا يَسِيرًاۙ) - O şəxs ki, onun əməl kağızı onun sağ əlinə verilər, əlbəttə onunla yüngül və asan haqq-hesab olunub, əzabdan nicat tapar.**

**9) (وَيَنْقَلِبُ اِلٰى اَهْلِهٖ مَسْرُورًاۜ) Haqq-hesabdan xilas olandan sonra fərəh və sevinclə özü kimi nicat tapan ailəsinin və qohum-əqrəbasının yanına qayıdıb, nicat tapması haqda onlara müjdə verər.**

**10-11) (وَاَمَّا مَنْ اُوتِيَ كِتَابَهُ وَرَاۤءَ ظَهْرِهٖۙ فَسَوْفَ يَدْعُو ثُبُورًاۙ) Amma o şəxs ki, onun əməl kağızı onun arxa tərəfindən** (sol əlinə) **verilər, əzab ediləcəyinə inanıb, özündən ötrü ah-nalə edib, vay, həlak oldum, deyəcək.**

**12) (وَيَصْلٰى سَعِيرًاۜ) - Əməlinin cəzasına görə cəhənnəmə daxil olar.**

**13) (اِنَّهُ كَانَ فٖى اَهْلِهٖ مَسْرُورًا) Həqiqətən, o şəxs dünyada Allah-Təalaya kafir və asi olub, axirəti inkar edib, ailəsinin, qohum-əqrəbasının arasında şad və fərəh içində olubdur. Küfr və unutqanlıq içində etdiyi şadlığın əvəzinə gərək axirətdə ağlayıb, əzaba düçar olsun.**

**14-15) (اِنَّهُ ظَنَّ اَنْ لَنْ يَحُورَۚ بَلٰىۚ اِنَّ رَبَّهُ كَانَ بِهٖ بَصِيرًاۜ)* Həqiqətən, əməl kağızı sol əlinə verilən şəxs elə etiqad edirdi ki, öləndən sonra yenidən dirilməyib, haqq-hesabdan ötrü qayıtmayacaqdır. Bəli, əlbəttə qayıdacaqdır. Həqiqətən, onun rəbbi Allah-Təala onun rəftarına və hərəkətinə agahdır. Əməllərinin cəzasını ona verəcəkdir.**

**(*Qeyd:** *"İbn Abbas deyir: "Ayədə vaqe olan "hur" kəlməsinin mənasına agah deyildim ki, bir dəfə səfər edib, bir qəbiləyə gedib gördüm ki, uzaq bir yerə gedən bir qadın balaca qızını çağırıb deyir: "Ya bəniyyə huri", qız bu kəlamı eşidən kimi qayıdıb, anasına tərəf getdi və o zaman anladım ki, bu kəlamın mənası "ey qızım, qayıt gəl" deməkdir və ayədəki "hur" da "qayıt" mənasındadır. Qurani-Şərif ərəbcə olduğuna görə, mənasını da gərək ərəblərdən öyrənək, yəni ərəbcəni mükəmməl öyrənib, ondan sonra Qurani-Şərifin mənasına agah olaq. Ərəbcə bilməyənlərin Qurani-Şərifin mənasından danışması nadanlıqdır. Müdrik Sənainin dediyi kimi:*

*İllər gərək bir uşağa lütfdən*
*Kamil bir alim, ya söz sahibi şair ola ).*

**16) (فَلَاۤ) - (Ey Məhəmməd), gərək müşriklər cidd-cəhdlə Quranı təkzib etməyi, islamın haqq olmasını inkar etməyi tərk etsinlər. (اُقْسِمُ بِالشَّفَقِۙ)** - (Ey

وَالَّيْلِ وَمَا وَسَقَ ۙ﴿١٧﴾ وَالْقَمَرِ اِذَا اتَّسَقَ ۙ﴿١٨﴾ لَتَرْكَبُنَّ طَبَقًا عَنْ طَبَقٍ ؕ﴿١٩﴾ فَمَا لَهُمْ لَا يُؤْمِنُونَ
ۙ﴿٢٠﴾ وَاِذَا قُرِئَ عَلَيْهِمُ الْقُرْاٰنُ لَا يَسْجُدُونَ ۜ﴿٢١﴾ بَلِ الَّذِينَ كَفَرُوا يُكَذِّبُونَ ۘ﴿٢٢﴾ وَاللّٰهُ اَعْلَمُ
بِمَا يُوعُونَ ۘ﴿٢٣﴾ فَبَشِّرْهُمْ بِعَذَابٍ اَلِيمٍ ۙ﴿٢٤﴾ اِلَّا الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ لَهُمْ اَجْرٌ غَيْرُ
مَمْنُونٍ ﴿٢٥﴾

---

Məhəmməd), **günəş batandan sonra qərbdə doğan şəfəqə and içirəm.**

**17) (وَالَّيْلِ وَمَا وَسَقَ ۙ) - Və gecəyə və istirahət etdirmək üçün əhatə etdiyi hər bir şeyə yenə and içirəm.** (Gecə olunca hər bir həyat sahibi bir zəruri işi yoxdursa, yuvasına, məskəninə dönər).

**18) (وَالْقَمَرِ اِذَا اتَّسَقَ) - Və on dörd gecəlik bədirlənmiş aya and içirəm.**

**19) (لَتَرْكَبُنَّ طَبَقًا عَنْ طَبَقٍ ؕ)** - (Ey Məhəmməd), **bu qeyd olunan şeylərə and içirəm ki, əlbəttə siz möminlər də bir haldan başqa bir hala keçib, islamın haqlılığı məlum olub, yer kürəsinə yayılacaq və sonunda müşriklərə qalib olacaqsınız.** (Bu xəbər uca peyğəmbərimizin doğruluğuna böyük dəlil və sübutdur. Ayədə xəbər verilən kimi möminlər müxtəlif vəziyyətlərə düşdülər, sonunda islam qüvvətlənib, müşriklərə qalib olub, Asiya və Afrikanın əksər yerlərinə hakim olub, dünyaya hökm etməyə çalışdılar. Haqq dəvətçilərinin doğruluğuna bu əvvəlki dövrlərdən böyük dəlil ola bilməz. Bu dövrdə bizim fəlakətə düçar olmağımızın səbəbi içimizdə zühur edən nifaq və ixtilafdır).

**20) (فَمَا لَهُمْ لَا يُؤْمِنُونَ ۙ)** - (Ey Məhəmməd), **islam haqq ola-ola, bu müşriklərə nə olubdur ki, iman etməyib, islama daxil olmurlar?**

**21) (وَاِذَا قُرِئَ عَلَيْهِمُ الْقُرْاٰنُ لَا يَسْجُدُونَ ۜ) - Və nə zaman ki, onlara Quran oxunar,** (yəni sən oxudun, Ey Məhəmməd), **yeganə Allah-Təalaya səcdə etməyib, Qurani-Şərifin tabe olunması vacib ehkamına təvazö ilə itaət etməzlər.**

**22) (بَلِ الَّذِينَ كَفَرُوا يُكَذِّبُونَ ۘ)** - (Ey Məhəmməd), **bəlkə də kafirlər Quranı təkzib edib, onun xəbərlərini qəbul etmirlər.** (Yəni Quranı təkzib edənlər əlbəttə, kafirdirlər).

**23) (وَاللّٰهُ اَعْلَمُ بِمَا يُوعُونَ ۘ) - Onların sinələrində gizlətdikləri küfr, nifaq, xəsislik, həsəd, inad, ədavətin hamısına Allah-Təala agahdır.**

**24) (فَبَشِّرْهُمْ بِعَذَابٍ اَلِيمٍ ۙ)** - (Ey Məhəmməd), **onların küfr və inadlarının səbəbinə onlara əziyyət verən əzabla müjdə ver.**

**25) (اِلَّا الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ لَهُمْ اَجْرٌ غَيْرُ مَمْنُونٍ) Ancaq o şəxslər ki, iman edib, xeyir əməl edirlər, onlardan ötrü Allah-Təalanın yanında sonsuz və əskik olmayan əcr və savab vardır.**

## *İnşiqaq surəsi*

Allaha həmd olsun, əl-İnşiqaq surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim əl-İnşiqaq surəsini oxusa, Allah-Təala qiyamət günündə onun əməl dəftərini arxa tərəfdən sol əlinə verməz."*

## əl-BURUC SURƏSİ

85-ci surədir. Məkkədə nazil olub, 22 ayə, 109 kəlmə və 465 hərfdir.

وَالسَّمَآءِ ذَاتِ الْبُرُوجِ ﴿١﴾ وَالْيَوْمِ الْمَوْعُودِ ﴿٢﴾ وَشَاهِدٍ وَمَشْهُودٍ ﴿٣﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (وَالسَّمَآءِ ذَاتِ الْبُرُوجِ)** (Ey Məhəmməd, 12*) **- Bürc sahibi olan səmaya and içirəm.**

**(*Qeyd:** *"On iki bürc on iki ulduz qrupundan ibarətdir ki, onların hər biri bir heyvan, ya da başqa bir surətdə zənn edilib, ərəb dilində onlara on iki ad verilib, bunlar şəmsi ərəb ayları sayılırlar. On iki bürcün adları bunlardır: 1-həməl (qoç), 2- səvr (buğa), 3-cövza (əkizlər). 4-sərətan (xərçəng), 5-əsəd (şir), 6-sünbülə (başaq, qız), 7-mizan (tərəzi), 8-əqrəb, 9-qövs (oxatan), 10-cədy (oğlaq), 11-dəlv (dolça), 12-hut (balıq). Qeyd olunan bu on iki ulduzu on iki heyvan və ya başqa bir surətdə təsəvvür edib, onlara on iki ad veriblər. Əgər biz müsəlmanlar hər bir hesabımızı bu on iki şəmsi aylarla hesablasaq, hesabımız dürüst olub, artıq-əskik olmaz. Lakin bəzi ehkamımız, məsələn, həcc, oruc bayramı kimi ay hesabıyla olduğuna görə digər hesabları da ay hesabı ilə hesablayanda hesabda əskiklik meydana gəlir. Digər hesablarımızı bu on iki şəms ayları ilə hesablamaqda şəriətcə bir problem yoxdur. Bəs niyə bizdə şəmsi təqvim olan halda gedib özgələrdən ay və təqvim alıb, hesabımızı onlarla edirik? Hələ bir özümüzü də məzəmmət edib deyirik: Çarə nədir? Müsəlmanda şəmsi təqvim yoxdur, bu səbəbdən gərək əcnəbilərin təqvimi ilə hesablayaq. Bu sözün cavabında deyirik: "Əzizim, müsəlmanda hər bir hesab və elm mövcuddur, lakin sən özün müsəlman ola-ola hər bir elmə və ehkama cahil olduğun üçün belə sözləri danışmağa cəsarət edirsən. Hər bir şəxs əvvəlcə gərək özünün ehkamını və dinini bilib, ondan sonra xaricilərin elm və ehkamına bələd olmalıdır).*

**2) (وَالْيَوْمِ الْمَوْعُودِ) - Və and olsun sizə vəd edilən** (qiyamət) **gününə, ya da ki, siz möminlərə vəd edilən qələbə gününə** (Bədir günü) **ki, o gündə müşriklərə qalib olacaqsınız.**

**3) (وَشَاهِدٍ وَمَشْهُودٍ) - Və and olsun qiyamət günündə hazır olan bütün insanlara və o gündə vaqe olan əcaib və qəribə işlərə, ya da ki, islamı möhkəmləndirmək üçün dünyaya gələn bu** (Məhəmmədə) **və ondan zühur edən əcaib və qəribə işlərə.** (Bu iki ayədə qeyd olunan ilk məna təfsirçilərin qeyd etdiyi mənaların içində ən yaxşısıdır, lakin ayələrdəki ikinci məna

قُتِلَ اَصْحَابُ الْاُخْدُودِۙ ﴿٤﴾ اَلنَّارِ ذَاتِ الْوَقُودِۙ ﴿٥﴾ اِذْ هُمْ عَلَيْهَا قُعُودٌۙ ﴿٦﴾ وَهُمْ عَلٰى مَا يَفْعَلُونَ
بِالْمُؤْمِنِينَ شُهُودٌۜ ﴿٧﴾ وَمَا نَقَمُوا مِنْهُمْ اِلَّا اَنْ يُؤْمِنُوا بِاللّٰهِ الْعَزِيزِ الْحَمِيدِۙ ﴿٨﴾

---

ayələrin islamın haqq din olduğunu isbat etmək üçün nazil olması baxımından bu kitabın müəllifi olan mən həqirin nəzərində daha yaxşıdır. Təfsirçilər ayələrdəki gizli mənaları təhqiq və tədqiq etməkdə özlərini çətinliyə salmayıb, məsələni dərhal qiyamətə həvalə etməyi özləri üçün daha asan sayıblar. Lakin ayələrin mənasında fəsahət və bəlağət, dərinlik axtarmaq daha doğrudur. Belə məsələləri ağıl sahiblərinin araşdırmasına həvalə edirəm).

**5) (قُتِلَ اَصْحَابُ الْاُخْدُودِۙ)** - (Ey Məhəmməd), **bu qeyd olunan şeylərə and içirəm ki, bu Məkkə əhlinə mənim lənətim şamil olub, onların haqqında layiqdir ki, belə deyilsin: öldürülüb, həlak olsunlar. Necə ki, bundan əvvəlki zamanlarda yeri qazıb böyük odlar* yandırıb, möminləri odda yandıranlara mənim lənətim şamil olub, onların haqqında deyildi ki, öldürülüb, həlak olsunlar.**

**(*Qeyd:** *"Ərəbistan yarımadasında Nəcran adlı yerdə məskun olan camaatın içinə bir şəxs gəlib onları İsanın (ə.s) dininə dəvət etdi. Onlar o şəxsin dəvətini qəbul edib, İsanın dininə daxil oldular. Himyər camaatına hakim olan Zünəvas adlı bir yəhudi Himyər camaatından qoşun toplayıb, Nəcran əhlinə hücum etdi. Onları İsanın dinini tərk edib, yəhudi dininə daxil olmağa dəvət etdi. Onlar qəbul etmədilər. Zünəvas onları yəhudi dininə daxil olmaqla odda yanmaq arasında sərbəst buraxdı. Onlar İsanın dinində qalıb, odda yanmağı seçdilər. Zünəvas əmr edib, yerdə xəndəklər qazdırıb, onlardan on iki min nəfəri odda yandırdı. Allah-Təala bu ayədə bu qissəyə işarə edib buyurur: "Necə ki, onlara mənim lənətim şamil olub, qiyamətdə sonsuz əzab edəcəm, habelə Ey Məhəmməd, bu Qüreyş tayfası da səni təkzib etdiyi üçün lənətim onlara şamil olub, əzab edəcəyəm).*

**5) (اَلنَّارِ ذَاتِ الْوَقُودِۙ) Yerdə qazılan xəndəklər böyük alovlu oda sahib idilər, o odlara möminləri salıb yandırırdılar.**

**6) (اِذْ هُمْ عَلَيْهَا قُعُودٌۙ) - O zaman ki, kafirlərin özləri də odun ətrafında əyləşirdilər,**

**7) (وَهُمْ عَلٰى مَا يَفْعَلُونَ بِالْمُؤْمِنِينَ شُهُودٌۜ) - Əyləşdikləri halda möminlərə etdikləri əzaba baxıb, tamaşa edirdilər.**

**8) (وَمَا نَقَمُوا مِنْهُمْ اِلَّا اَنْ يُؤْمِنُوا بِاللّٰهِ الْعَزِيزِ الْحَمِيدِۙ) - Möminlərə məxluqata qalib və əzəmətli olan, həmd-sənaya layiq olan Allah-Təalaya iman etməkdən başqa bir şeyi eyib saymadılar. Ancaq bu səbəbdən onları yandırdılar.**

اَلَّذِي لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِ ۜ وَاللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ شَهِيدٌ ۜ ﴿٩﴾ اِنَّ الَّذِينَ فَتَنُوا الْمُؤْمِنِينَ
وَالْمُؤْمِنَاتِ ثُمَّ لَمْ يَتُوبُوا فَلَهُمْ عَذَابُ جَهَنَّمَ وَلَهُمْ عَذَابُ الْحَرِيقِ ۜ ﴿١٠﴾ اِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا
الصَّالِحَاتِ لَهُمْ جَنَّاتٌ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ ۜ ذٰلِكَ الْفَوْزُ الْكَبِيرُ ۜ ﴿١١﴾ اِنَّ بَطْشَ رَبِّكَ لَشَدِيدٌ
ۜ ﴿١٢﴾ اِنَّهُ هُوَ يُبْدِئُ وَيُعِيدُ ۚ ﴿١٣﴾ وَهُوَ الْغَفُورُ الْوَدُودُ ۙ ﴿١٤﴾ ذُو الْعَرْشِ الْمَجِيدُ ۙ ﴿١٥﴾ فَعَّالٌ
لِمَا يُرِيدُ ۜ ﴿١٦﴾ هَلْ اَتٰيكَ حَدِيثُ الْجُنُودِ ۙ ﴿١٧﴾ فِرْعَوْنَ وَثَمُودَ ۜ ﴿١٨﴾

---

**9) (**اَلَّذِي لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِ ۜ وَاللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ شَهِيدٌ ۜ**) Allah-Təalanın sifətlərindən biri budur ki, səmaların və yerin hakimiyyəti ona məxsusdur və hər bir şeyə şahid olub möminləri yandıran yəhudilərin əməllərinə də agahdır. Onların cəzasını verəcəkdir.**

**10) (**اِنَّ الَّذِينَ فَتَنُوا الْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ ثُمَّ لَمْ يَتُوبُوا فَلَهُمْ عَذَابُ جَهَنَّمَ وَلَهُمْ عَذَابُ الْحَرِيقِ ۜ**)** - (Ey Məhəmməd), **həqiqətən, o şəxslər ki, Allah-Təalaya iman edən kişilərə və qadınlara əzab edib, onları həlak etdilər,** (Nəcran əhlinə əzab edənlər kimi), **ondan sonra tövbə etməyib, imana daxil olmadılar, onlardan ötrü cəhənnəm əzabı və cəhənnəmdə yandıran əzab hazırdır.**

**11) (**اِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ لَهُمْ جَنَّاتٌ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ ۜ ذٰلِكَ الْفَوْزُ الْكَبِيرُ**) Həqiqətən, o şəxslər ki, Allah-Təalaya iman edib, gözəl əməllər edirlər, onlardan ötrü ağaclarının və qəsrlərinin altından çaylar axan bağlar hazırdır.** (Ey Məhəmməd), **böyük əcr və savaba yetişmək budur.**

**12) (**اِنَّ بَطْشَ رَبِّكَ لَشَدِيدٌ ۜ**)** - (Ey Məhəmməd), **həqiqətən, sənin rəbbin Allah-Təalanın zalımlara olan əzabı çox şiddətlidir. Onlara xəyala gəlməyən əzab edəcəkdir.**

**13) (**اِنَّهُ هُوَ يُبْدِئُ وَيُعِيدُ ۚ**) - Və həqiqətən, Allah-Təala öz kamil qüdrəti ilə necə ki, yoxdan onları meydana gətirib, yenidən dirildib, məhşərdə hazır etməyə də qadirdir.**

**14) (**وَهُوَ الْغَفُورُ الْوَدُودُ ۙ**) Tövbə edənlərin günahını bağışlayan və itaət edənlərlə dost kimi rəftar edib, lütf edən Allah-Təaladır.**

**15) (**ذُو الْعَرْشِ الْمَجِيدُ ۙ**) Şanı böyük və bütün varlığa hakim olan taxt sahibi Allah-Təaladır.**

**16) (**فَعَّالٌ لِمَا يُرِيدُ ۜ**) Allah-Təala hər istədiyini edəndir. Heç bir şey ona mane olan, ya da ki, onu aciz edən deyildir.**

**17) (**هَلْ اَتٰيكَ حَدِيثُ الْجُنُودِ ۙ فِرْعَوْنَ وَثَمُودَ ۜ**)** - (Ey Məhəmməd), **Allah-Təalaya kafir olan firon və Səmud camaatının qissəsi** (hansı ki, Allah-Təalaya asi olub, peyğəmbərləri təkzib etdilər, Allah-Təala da onlara əzab göndərdi) **sənə gəldimi? Əlbəttə, onların qissələrini Quranda qeyd etmişik və onların əhvalatına agah olubsan.**

بَلِ الَّذِينَ كَفَرُوا فِي تَكْذِيبٍ ﴿١٩﴾ وَاللَّهُ مِنْ وَرَآئِهِمْ مُحِيطٌ ﴿٢٠﴾ بَلْ هُوَ قُرْآنٌ مَجِيدٌ ﴿٢١﴾
فِي لَوْحٍ مَحْفُوظٍ ﴿٢٢﴾

---

**19) (بَلِ الَّذِينَ كَفَرُوا فِي تَكْذِيبٍ)** - (Ey Məhəmməd), **bəlkə də sənin qövmündən kafir olanlar səni və Quranı təkzib edirlər, necə ki, əvvəlkilər təkzib ediblər. Biz onların əhvalına agahıq və əzab etməyə də qadirik. Heç vaxt bizdən qurtula bilməyəcəklər.**

**20) (وَاللَّهُ مِنْ وَرَآئِهِمْ مُحِيطٌ) Allah-Təala onları hər bir tərəfdən əhatə edib, Onun qüdrətindən qurtula bilməyəcəklər.**

**21-22) (بَلْ هُوَ قُرْآنٌ مَجِيدٌ فِي لَوْحٍ مَحْفُوظٍ)** - (Ey Məhəmməd), **bu təkzib etdikləri Quran kitablar arasında uca dərəcəli, şərəfli, çox faydalı və ecazkar bir kitab olub, "lövhi-məhfuz"da (ilahi elmdə) sabit və bərqərardır, oradan Məhəmmədin qəlbinə nazil olan bir kitabdır. Ona şəkk-şübhə etmək layiq deyildir.** (Hər bir ağıl sahibi təfəkkür edəndən sonra əlbəttə, onun haqq olduğunu dərk edib, qəbul edəcəkdir).

Allaha həmd olsun, əl-Buruc surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim əl-Buruc surəsini oxusa, Allah-Təala cümə və ərəfə gününün hesabı qədər ona on savab bəxş edər."*

## ət-TARİQ SURƏSİ

86-cı surədir. Məkkədə nazil olub, 17 ayə, 61 kəlmə və 239 hərfdir.

وَالسَّمَآءِ وَالطَّارِقِۙ ﴿١﴾ وَمَآ اَدْرٰيكَ مَا الطَّارِقُۙ ﴿٢﴾ اَلنَّجْمُ الثَّاقِبُۙ ﴿٣﴾ اِنْ كُلُّ نَفْسٍ لَمَّا عَلَيْهَا
حَافِظٌۜ ﴿٤﴾ فَلْيَنْظُرِ الْاِنْسَانُ مِمَّ خُلِقَۜ ﴿٥﴾ خُلِقَ مِنْ مَآءٍ دَافِقٍۙ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (وَالسَّمَآءِ وَالطَّارِقِۙ)** - (Ey Məhəmməd), **and olsun səmaya və gecələr zühur edən nurani ulduzlara.**

**2) (وَمَآ اَدْرٰيكَ مَا الطَّارِقُۙ)** - (Ey Məhəmməd), **Tariqin** (nurani ulduzların) **həqiqətini sən nə bilirsən? Allah-Təaladan başqa heç kim onların həqiqətini sənə bildirməz.**

**3) (اَلنَّجْمُ الثَّاقِبُۙ) - Onlar işıq verən və işıqlarıyla qaranlığı dəlib işıqlarını izhar edən ulduzlardır.**

**4) (اِنْ كُلُّ نَفْسٍ لَمَّا عَلَيْهَا حَافِظٌۜ)** - (Ey Məhəmməd), **and olsun bu qeyd olunan şeylərə ki, heç kim özbaşına buraxılmayıb. Onların hər bir əməllərinə bizim tərəfimizdən bir gözətçi vardır ki, onların əməlləri qeyd olunub,* cəzası onlara veriləcəkdir.**

**(*Qeyd:** *Hər bir xeyir və şər əməlin qarşılığı axirətdən qabaq öz sahibinə yetişəcəkdir. Şeyx Nizami belə deyir:*

*Çunki pislik etdin cirkinliklerden (pisliklerden ) əmin olma*
*Allahin buyurduqlari sənə vacib oldu.*

*Başqa bir şair də belə deyir:*

*Vacib əməllərdən qafil olma,*
*Buğda buğdadan, arpa arpadan göyərər.)*

**5-6) (فَلْيَنْظُرِ الْاِنْسَانُ مِمَّ خُلِقَۜ) Gərək insan öz əslinə və necə əskik bir şeydən yaradılmasına baxıb, ilk yaradılışına agah olsun. Ondan sonra bilsin ki, birinci dəfə onu yaradan, ikinci dəfə də yaradıb, cəza verməyə qadirdir və bu səbəbdən cəza günündən ötrü gözəl əməllər hazırlayıb, onun müqabilində gözəl mükafatlara ümidvar olsun. (خُلِقَ مِنْ مَآءٍ دَافِقٍۙ) - İnsan atadan ana bətninə tökülən sudan** (spermadan) **yaradılıbdır.**

يَخْرُجُ مِنْ بَيْنِ الصُّلْبِ وَالتَّرَآئِبِۜ ﴿٧﴾ اِنَّهُ عَلٰى رَجْعِهٖ لَقَادِرٌۜ ﴿٨﴾ يَوْمَ تُبْلَى السَّرَآئِرُۙ ﴿٩﴾ فَمَا لَهُ
مِنْ قُوَّةٍ وَلَا نَاصِرٍۜ ﴿١٠﴾ وَالسَّمَآءِ ذَاتِ الرَّجْعِۙ ﴿١١﴾ وَالْاَرْضِ ذَاتِ الصَّدْعِۙ ﴿١٢﴾ اِنَّهُ لَقَوْلٌ
فَصْلٌۙ ﴿١٣﴾ وَمَا هُوَ بِالْهَزْلِۜ ﴿١٤﴾ اِنَّهُمْ يَكِيدُونَ كَيْدًاۙ ﴿١٥﴾ وَاَكِيدُ كَيْدًاۚ ﴿١٦﴾

---

**7) (يَخْرُجُ مِنْ بَيْنِ الصُّلْبِ وَالتَّرَآئِبِۜ) - O sperma insanın kürək** (bel) **sümüyü ilə sinə sümüklərinin arasında yerləşən cinsiyyət orqanından çıxıb, ananın bətnində bir-birinə qarışıb, ondan insan yaranar.**

**8) (اِنَّهُ عَلٰى رَجْعِهٖ لَقَادِرٌۜ) - İnsanı birinci dəfə spermadan yaradan Allah-Təala həqiqətən, yenidən onu diriltməyə əlbəttə ki, qadirdir.**

**9) (يَوْمَ تُبْلَى السَّرَآئِرُۙ) Allah-Təalanın insanı dirildəcəyi gün qəlblərdə olan bütün sirlər və əqidələr, niyyətlər tamamilə aşkar olub, yaxşı-yaman bir-birindən ayrılacaqdır.**

**10) (فَمَا لَهُ مِنْ قُوَّةٍ وَلَا نَاصِرٍۜ) Qiyaməti inkar edən insanın nə Allah-Təalanın əzabını dəf edə bilən bir gücü, nə də kənardan ona bir kömək edən olmaz.**

**11-12) (وَالسَّمَآءِ ذَاتِ الرَّجْعِۙ وَالْاَرْضِ ذَاتِ الصَّدْعِۙ)** - (Ey Məhəmməd), **yağış sahibi olan göyə və yağış səbəbinə yarılıb, hər bir növ ot-ələf və ağac sahibi olan yerə and olsun.**

**13-14) (اِنَّهُ لَقَوْلٌ فَصْلٌۙ وَمَا هُوَ بِالْهَزْلِۜ) Həqiqətən, bu Quran haqla batil arasında fərq qoyan bir kəlamdır. Boş və batil söz deyildir və belə olan halda gərək Qurana təzim və hörmət edib, onun açıq-aydın ayələrinə tabe olmaqla hidayət tapıb, haqqa qovuşaq.**

**15-16) (اِنَّهُمْ يَكِيدُونَ كَيْدًاۙ وَاَكِيدُ كَيْدًاۚ)** - (Ey Məhəmməd), **həqiqətən, müşriklər bizim əmrimizi batil edib, haqqın çırağını söndürmək** (səni məhv etmək) **üçün məkr, hiylə edib, səbəb* axtarırlar. Mən də onların məkr və hiylələrinin müqabilində, cəzalarını intiqam anına qədər təxirə salıb, dünya və axirətdə onlardan intiqam alacağam.**

**(*Qeyd:** *Məkkədə müşriklər Darün-Nədvədə - şura məclisində toplanıb, peyğəmbəri öldürmək üçün məşvərət etdilər. Çox danışıqlardan sonra hamısının rəyi belə oldu ki, hər qəbilədən bir nəfər seçilib, gecə vaxtı o cənabın üstünə hücum edib onu qətl etsinlər. O vaxt da Allah-Təala peyğəmbərə Mədinəyə hicrət etməyi əmr etdi. Mədinəyə hicrət edəndən sonra hicrətin ikinci ilində Bədir adlı yerdə müsəlmanlar müşriklərlə savaşdılar. Allah-Təala müsəlmanları müşriklərə qalib edib, onlardan intiqam aldı. Hicrətin və Bədir savaşının təfsilatı kitabın I cildində - Ənfal və Tövbə surələrinin təfsirində keçdi).*

فَمَهِّلِ الْكَافِرِينَ اَمْهِلْهُمْ رُوَيْدًا ﴿١٧﴾

---

**17) (فَمَهِّلِ الْكَافِرِينَ اَمْهِلْهُمْ رُوَيْدًا) -** (Ey Məhəmməd), **müşriklərə qalib olmaq üçün tələsib, dua etmə. Onlara bir az möhlət ver. Elə ki, möhlətləri qurtardı, mən onlardan intiqam alacam.** (Az bir müddətdən sonra Allah-Təala onlardan intiqam aldı).

Allaha həmd olsun, ət-Tariq surəsinin təfsiri tamamlandı. Allahın Rəsuli (ə.s) buyurdu: *“Kim ət-Tariq surəsini oxusa, Allah-Təala səmada olan ulduzların hər birinin qarşılığında ona on savab bəxş edər.”*

## əl-ƏLA SURƏSİ

87-ci surədir. Məkkədə nazil olub, 19 ayə, 172 kəlmə və 291 hərfdir.

سَبِّحِ اسْمَ رَبِّكَ الْاَعْلٰىۙ ﴿١﴾ اَلَّذِي خَلَقَ فَسَوّٰىۖ ﴿٢﴾ وَالَّذِي قَدَّرَ فَهَدٰىۖ ﴿٣﴾ وَالَّذِيٓ اَخْرَجَ
الْمَرْعٰىۖ ﴿٤﴾ فَجَعَلَهُ غُثَٓاءً اَحْوٰىۜ ﴿٥﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (سَبِّحِ اسْمَ رَبِّكَ الْاَعْلٰىۙ)*** (Ey Məhəmməd), **rəbbin Allah-Təalanın hər bir şeydən uca olan müqəddəs zatını ona layiq olmayan hər bir qəbih sifət və mənadan pak və müqəddəs say.**

**(*Qeyd:** *"Elə ki, bu mübarək surə nazil oldu, Allahın Rəsulu buyurdu: "Sübhanə rəbbiyəl-əla" ("Allahım, nə pak və ucasan!"), ondan sonra buyurdu: "Bu zikri namazın səcdəsində oxuyun. Vaqiə surəsində "ulu olan Rəbbinin adını müqəddəs tutub zikr et!" ayəsi nazil olanda buyurdu: "Sübhanə rəbbiyəl-əla", ondan sonra buyurdu: "Bu zikri namazın rükusunda oxuyun. Bu mətləbi bütün təfsirçilər qeyd ediblər. Lakin bununla belə mən həqir islam ümmətinin böyük bir hissəsinin əksər alimlərini namaz qılan halda müşahidə etmişəm ki, rüku və səcdədə əsla bu zikri deməyib, rüku və səcdəni sükut içində yerinə yetirirlər. Çox təəccüblüdür, bu zikrlər vacib olmasa da, hər halda savab olub, Allahın tənzih və təqdisini ehtiva edir. Zikr demək deməməkdən daha yaxşı deyilmi?)*

**2) (اَلَّذِي خَلَقَ فَسَوّٰى) Allah-Təala öz kamil qüdrəti ilə hər bir şeyi yaradıb, möhkəm və bərabər, hissələrini bir-birinə mütənasib etdi.**

**3) (وَالَّذِي قَدَّرَ فَهَدٰى) - Və yenə Allah öz kamil qüdrəti ilə hər bir həyat sahibindən ötrü onun hal və şanını islah edən hər bir şeyi təqdir edib, həmin həyat sahibini o şey tərəfinə hidayət etdi.** (Hər bir heyvan Allah-Təalanın bəxş etdiyi şüur ilə öz məişətini dolandırır. Dənizdə və çöldə həddi-hesabı olmayan heyvanların hər bir növü üçün, hətta insanlardan ötrü məişətlərini təmin etmək üçün müəyyən məsləklər yaratmaq vəsf edilməklə bitməz. Allahım, sənin şanın nə pak və ucadır!)

**4) (وَالَّذِيٓ اَخْرَجَ الْمَرْعٰىۙ) - Və yenə Allah-Təala öz kamil qüdrəti ilə sizin heyvanlarınızdan ötrü ot-ələf göyərdib, otlaqlar yaratdı.**

**5) (فَجَعَلَهُ غُثَٓاءً اَحْوٰىۜ) - Otlaqlar göyərib, yetişəndən sonra onları qurudub, qaraltdı.**

سَنُقْرِئُكَ فَلَا تَنْسٰىۙ ﴿٦﴾ اِلَّا مَا شَٓاءَ اللّٰهُۜ اِنَّهُ يَعْلَمُ الْجَهْرَ وَمَا يَخْفٰىۜ ﴿٧﴾ وَنُيَسِّرُكَ لِلْيُسْرٰىۚ ﴿٨﴾
فَذَكِّرْ اِنْ نَفَعَتِ الذِّكْرٰىۜ ﴿٩﴾ سَيَذَّكَّرُ مَنْ يَخْشٰىۙ ﴿١٠﴾ وَيَتَجَنَّبُهَا الْاَشْقٰىۙ ﴿١١﴾ اَلَّذ۪ي يَصْلَى
النَّارَ الْكُبْرٰىۚ ﴿١٢﴾ ثُمَّ لَا يَمُوتُ ف۪يهَا وَلَا يَحْيٰىۜ ﴿١٣﴾ قَدْ اَفْلَحَ مَنْ تَزَكّٰىۙ ﴿١٤﴾

---

**6) (سَنُقْرِئُكَ فَلَا تَنْسٰىۙ)** - (Ey Məhəmməd), **sənə nazil olan Quran ayələrini əzbərləməyə tələsmə, biz özümüz Quranı sənə oxuyuruq ki, o, sənin yadından çıxmasın.**

**7) (اِلَّا مَا شَٓاءَ اللّٰهُۜ اِنَّهُ يَعْلَمُ الْجَهْرَ وَمَا يَخْفٰىۜ) Quranı unutmazsan. Ancaq Allah-Təala bir ayəni** (məsələn), **unutmanı istəsə, o vaxt unudarsan. Unutmaq qorxusundan gah uca səslə, ya da gizlicə oxusan, Allah-Təala hər ikisinə də agahdır. Uca səslə, ya da gizlicə oxumağın heç biri unutmağa mane deyil. Ancaq Allah-Təala istəsə unutdurar.**

**8) (وَنُيَسِّرُكَ لِلْيُسْرٰىۚ)** - (Ey Məhəmməd), **sənə yardım edib, asan olan elə bir şəriəti sənə bəxş edirik ki, heç bir şəkildə sənin şəriətində ağır və məşəqqət olmasın.** (İlahi, sən Hz. Məhəmmədin şəriətini asan yaratmısan. Lakin bizim müftilərimiz şəriəti bizdən ötrü çətinləşdiriblər. Sənin əmr etdiyin sözləri qoyub, onlara itaət etmək olmaz. İlahi, yardım et!)

**9) (فَذَكِّرْ اِنْ نَفَعَتِ الذِّكْرٰىۜ)** - (Ey Məhəmməd), **bu vaxta kimi kafir və müşriklərə çox öyüd-nəsihət edibsən, bundan sonra onlara nəsihət fayda etməyib, iman etməzlər. Əgər fayda verərsə, nəsihət et, lakin fayda verməz.**

**10) (سَيَذَّكَّرُ مَنْ يَخْشٰىۙ) Təfəkkür edib, haqqa tabe olub, Allah-Təaladan qorxan şəxslər agah olub, nəsihəti qəbul edib, mənfəət əldə edərlər, amma haqdan üz döndərənlərin nəsihəti qəbul edəcəyinə ümid etmə.**

**11-12) (وَيَتَجَنَّبُهَا الْاَشْقٰىۙ اَلَّذ۪ي يَصْلَى النَّارَ الْكُبْرٰىۚ)** - (Ey Məhəmməd), **kafirlərin ən asiləri** (Məkkədə Vəlid, Utbə, Əbu Cəhl kimi şəxslər, bu dövrdə olan inadkarlar və münafiqlər) **sənin öyüd-nəsihətini qəbul etməkdən uzaq durub, üz döndərirlər, cəhənnəm odunda əzaba düçar olacaqlar.**

**13) (ثُمَّ لَا يَمُوتُ ف۪يهَا وَلَا يَحْيٰىۜ) - Cəhənnəm oduna daxil olandan sonra nə ölüb, əzabdan xilas ola bilər, nə də elə diri olmaz ki, diriliyindən mənfəət əldə etsin.** (Əlidən (ə.s) rəvayət olunubdur ki, bundan sonra növbəti ayələr Ramazan və Qurban bayramı namazını qılmadan əvvəl fitrə-sədəqə vermək haqqında nazil olubdur).

**14) (قَدْ اَفْلَحَ مَنْ تَزَكّٰىۙ)** - (Ey Məhəmməd), **o şəxs ki, bayram namazını qılmamış zəkat, fitrə versə, həqiqətən, o şəxs əcr və savaba çatıb, əzabdan nicat tapar.**

وَذَكَرَ اسْمَ رَبِّهٖ فَصَلّٰىۜ ﴿١٥﴾ بَلْ تُؤْثِرُونَ الْحَيٰوةَ الدُّنْيَاۘ ﴿١٦﴾ وَالْاٰخِرَةُ خَيْرٌ وَاَبْقٰىۜ ﴿١٧﴾ اِنَّ
هٰذَا لَفِي الصُّحُفِ الْاُو۫لٰىۙ ﴿١٨﴾ صُحُفِ اِبْرٰهٖيمَ وَمُوسٰى ﴿١٩﴾

---

**15) (وَذَكَرَ اسْمَ رَبِّهٖ فَصَلّٰىۜ) Fitrəni verməklə birlikdə rəbbi Allah-Təalanın adını zikr edib** (etiqadı üzrə Allahu-əkbər deyib), **ondan sonra bayram namazını qılsa, belə şəxs əlbəttə, nicat tapacaqdır.** (Ayəyə görə namazdan əvvəl "təkbir"-"Allahu əkbər" demək vacibdir).

**16) (بَلْ تُؤْثِرُونَ الْحَيٰوةَ الدُّنْيَاۘ) - Bəlkə də siz axirəti unudub, ancaq dünya həyatını axirətə üstün tutub, nəfsani arzulara tabe olub, nicata bais olan əməlləri** (fitrə verib, bayram namazı qılmaq və s.) **tərk edirsiniz.**

**17) (وَالْاٰخِرَةُ خَيْرٌ وَاَبْقٰىۜ) Halbuki** (birincisi) **- axirət dünyadan daha yaxşı bir məkan və mənzildir. Hər bir cəhətdən istirahət yeridir.** (İkincisi) **- əbədidir, fani olmayandır. Ağıllı şəxs fanini əbədiyə üstün saymaz. Siz dünyada din və millətə xeyir verən əməllərə yönəlin, onun əvəzində Allah-Təala da sizə axirətdə gözəl əcr və savablar versin.**

**18-19) (اِنَّ هٰذَا لَفِي الصُّحُفِ الْاُو۫لٰىۙ صُحُفِ اِبْرٰهٖيمَ وَمُوسٰى)** - (Ey Məhəmməd), **həqiqətən, bu surədə qeyd olunan kəlamların mənası keçmiş peyğəmbərlərə nazil olan kitabların hamısında xüsusən, İbrahim və Musaya nazil olan kitablarda qeyd olunubdur. Bu sözlər təkcə Quranda qeyd olunmayıb.**

Allaha həmd olsun, əl-Əla surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) "Sübhanə rəbbiyəl-əla" deməyi çox sevərdi və bu səbəbdən namazın səcdəsində bu kəlamı zikr edərdi. Hər vaxt bu surəni oxuyanda "Sübhanə rəbbiyəl-əla" deyərdi, Əli və İbn Abbas da belə deyərdilər. Allahın Rəsulu buyurdu: *"Kim əl-Əla surəsini oxusa, Allah-Təala İbrahimə, Musaya və Məhəmmədə nazil etdiyi kitabların hər bir hərfinə qarşılıq ona on savab verər."*

## əl-ĞAŞİYƏ SURƏSİ

88-ci surədir. Məkkədə nazil olub, 26 ayə, 92 kəlmə və 381 hərfdir.

هَلْ اَتٰيكَ حَدٖيثُ الْغَاشِيَةِؕ ﴿١﴾ وُجُوهٌ يَوْمَئِذٍ خَاشِعَةٌۙ ﴿٢﴾ عَامِلَةٌ نَاصِبَةٌۙ ﴿٣﴾ تَصْلٰى نَارًا حَامِيَةًۙ ﴿٤﴾ تُسْقٰى مِنْ عَيْنٍ اٰنِيَةٍؕ ﴿٥﴾ لَيْسَ لَهُمْ طَعَامٌ اِلَّا مِنْ ضَرٖيعٍۙ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (هَلْ اَتٰيكَ حَدٖيثُ الْغَاشِيَةِؕ)** - (Ey Məhəmməd), **insanların hamısına şamil olan bəla və müsibət** (qiyamət) **xəbəri sənə gəlib çatıbmı? Bizim tərəfimizdən sənə xəbər verilibdir.**

**2) (وُجُوهٌ يَوْمَئِذٍ خَاشِعَةٌ) - Ogünkü gündə bəzi üzlər (kafir və asilərin üzləri) həqir və zəlil olarlar.** (Həqirlik və zillətin əlaməti üzdən göründüyünə görə Allah həqir və zəlil olmağı üzə isnad edib).

**3) (عَامِلَةٌ نَاصِبَةٌ) Həqir və zəlil olan üzlərin sahibləri dünyada özlərini məşəqqətə salıb, hər bir qəbih və günah əməllərə yönələn şəxslərdir.**

**4)* (تَصْلٰى نَارًا حَامِيَةًۙ) - O üzlərin sahibləri şiddətli, qaynar odun ortasına düşüb, qərq olarlar.**

**(*Qeyd:** *"sala" kəlməsi sadəcə oda daxil olmaq mənasında deyildir. Əksinə, xüsusi şəkildə oda daxil olmaq mənasındadır. Məsələn, bir çuxur yer qazıb, onun içində çoxlu od yandırılar və bir heyvanın ətini kabab üçün bişirməkdən ötrü həmin odun içinə daxil edib, üstü örtülsə, belə oda daxil olmağa "sala" deyilir. Ayədən məqsəd bu mənadır. Yəni onlar odun ortasına elə atılarlar ki, onlardan heç bir iz qalmaz).*

**5a) (تُسْقٰى مِنْ عَيْنٍ اٰنِيَةٍؕ) Son dərəcə qaynar çeşmənin suyundan onlara içirdərlər.**

**6) (لَيْسَ لَهُمْ طَعَامٌ اِلَّا مِنْ ضَرٖيعٍۙ) - Cəhənnəm əhlindən ötrü "zəri"dən*** (zəhərli və acı bitki) **başqa bir yemək olmaz.**

**(*Qeyd:** *"zəri" tikanlı otdur. Yaşıl rəngdə olanda Qüreyş camaatı ona "şibrik" adı verirdilər. Elə ki, qurudu, "zəri" adı verirdilər. Quruyandan sonra tikanları iti və möhkəm olur. Allah-Təala cəhənnəm əhlindən ötrü belə həlak edici bir ruzi hazırlayıb. Lakin onun həqiqəti bizə məlum olmadığından adət-ənənəyə görə ona "zəri" adını verir. Habelədir, cəhənnəmin digər qidalarının həqiqəti və cənnətin müxtəlif nemətləri. Allah-Təala cəhənnəm əzabını, cənnət nemətlərini*

لَا يُسْمِنُ وَلَا يُغْنِي مِنْ جُوعٍ ﴿٧﴾ وُجُوهٌ يَوْمَئِذٍ نَاعِمَةٌ ﴿٨﴾ لِسَعْيِهَا رَاضِيَةٌ ﴿٩﴾ فِي جَنَّةٍ عَالِيَةٍ
﴿١٠﴾ لَا تَسْمَعُ فِيهَا لَاغِيَةً ﴿١١﴾

---

*dünyada adət etdiyimiz şeylərlə bizə xəbər verir, yoxsa bunları bizim dərk etməmiz mümkün deyil).*

**7) (لَا يُسْمِنُ وَلَا يُغْنِي مِنْ جُوعٍ) "Zəri" insan ruzisi olmadığından insan ondan nifrət edər, o, nə bədənə qüvvət verir, nə də aclıqdan qurtarar. Belə şey qida olmayıb, ancaq əzabdan ötrü olacaqdır.**

**8) (وُجُوهٌ يَوْمَئِذٍ نَاعِمَةٌ)** (Ey Məhəmməd)***, bəzi üzlər** (möminlərin üzləri) **qiyamət günündə fərəh və sevinc içində olub, nemət və lütf sahibi olmaları aydın olar.**

**(*Qeyd:** *"Bu ayədə qeyd olunan nemətləri dünya nemətləri də saymaq mümkündür. Ayələrin mənasına da zidd deyil. Əksinə, peyğəmbərimizin doğruluğuna böyük bir dəlil və sübut olar. Müqəddəs torpaqlardan olan Suriyanı (Şamı) Ərəbistan yarımadası ilə müqayisə edəndə həqiqətən də ona cənnət demək olar. Uca peyğəmbərimiz Şamın fəthini möminlərə vəd edərkən, Allah-Təala da ayədə müqəddəs torpaqlarda olan nemətləri qabaqcadan onlara vəd edir ki, cihad işində möhkəm və savaşmağa hazır olsunlar. Habelə surənin əvvəlində qeyd olunan əzablardan, qaynar su və "zəri" yeməyindən məqsəd müqəddəs torpaqlar üçün cihada getməyib, Ərəbistan yarımadasında qalanlara xəbərdarlıq etməkdir ki, o su və o yemək onlardan ötrü əbədi ruzi olacaqdır. Ayələrdə məqsəd cihad edib, islamı dünyaya yaymaq olduğundan cihadı tərk edənlərin daim Ərəbistan yarımadasının əzabında, cihad edənlərin isə cənnət kimi olan müqəddəs torpaqlarda yaşayacağını xəbər verib, onları islamı yaymağa həvəsləndirməkdir. Bu məna din və millət üçün daha faydalıdır. Lakin bu kitabı oxuyanlar mən həqirə etiqadsızlıq isnad edib, hiddətlənməsinlər. Açıq-aşkar deyirəm ki, mən həqir qiyaməti, cənnət və cəhənnəmi və onlarda olan nemətləri və əzabı qətiyyən inkar etmirəm. Necə inkar etmək olar ki, Qurani-Şərifdə açıq-aşkar qeyd olunubdur. Mən həqir müəllif bu kitabın hər yerində cənnət və cəhənnəm ayələrini olduğu kimi təfsir etmişəm. Amma bu surənin ayələrində qeyd olunan nemət və əzabları dünya nemət və əzabı saymaq ayələrin öz mənasından bəlli olur. Bəsirət sahiblərinin diqqət etməsi tövsiyə olunur).*

**9) (لِسَعْيِهَا رَاضِيَةٌ) - O üzlərin sahibləri elə ki, Allah-Təalanın onlara bəxş etdiyi nemətləri gördülər, dünyada etdikləri itaət və əməllərindən razı qalarlar.**

**10) (فِي جَنَّةٍ عَالِيَةٍ) - Dərəcəsi uca olan cənnətdə olarlar.**

**11) (لَا تَسْمَعُ فِيهَا لَاغِيَةً) - O cənnətdə bir kəlmə də boş və batil söz eşitməzlər.**

فِيهَا عَيْنٌ جَارِيَةٌ ﴿١٢﴾ فِيهَا سُرُرٌ مَرْفُوعَةٌ ﴿١٣﴾ وَاَكْوَابٌ مَوْضُوعَةٌ ﴿١٤﴾ وَنَمَارِقُ مَصْفُوفَةٌ ﴿١٥﴾ وَزَرَابِيُّ مَبْثُوثَةٌ ﴿١٦﴾ اَفَلَا يَنْظُرُونَ اِلَى الْاِبِلِ كَيْفَ خُلِقَتْ ﴿١٧﴾ وَاِلَى السَّمَاءِ كَيْفَ رُفِعَتْ ﴿١٨﴾ وَاِلَى الْجِبَالِ كَيْفَ نُصِبَتْ ﴿١٩﴾ وَاِلَى الْاَرْضِ كَيْفَ سُطِحَتْ ﴿٢٠﴾ فَذَكِّرْ اِنَّمَا اَنْتَ مُذَكِّرٌ ﴿٢١﴾ لَسْتَ عَلَيْهِمْ بِمُصَيْطِرٍ ﴿٢٢﴾

---

**12) (فِيهَا عَيْنٌ جَارِيَةٌ) - O cənnətdə hər bir tərəfə bol axan çeşmələr olacaqdır.**

**13) (فِيهَا سُرُرٌ مَرْفُوعَةٌ) - O cənnətdə möminlərdən ötrü uca taxtlar hazırlanıbdır.**

**14) (وَاَكْوَابٌ مَوْضُوعَةٌ) - Üzlərini hansı tərəfə çevirsələr, içmələri üçün piyalələr qoyulubdur.**

**15) (وَنَمَارِقُ مَصْفُوفَةٌ) Söykənmələri üçün bir-birinin yanına düzülmüş balışlar onlardan ötrü hazırlanmışdır. Nə vaxt istəsələr əyləşib, onlara söykənərlər.**

**16) (وَزَرَابِيُّ مَبْثُوثَةٌ) - Onların məclislərində böyük və enli xalılar açılıb, döşənibdir. Bu nemətlərin hamısı onlardan ötrü hazırlanıbdır.**

**17) (اَفَلَا يَنْظُرُونَ اِلَى الْاِبِلِ كَيْفَ خُلِقَتْ)** - (Ey Məhəmməd), **bizim kamil qüdrətimizi inkar etməsinlər, bəs diqqət edib* dəvəyə baxmırlar ki, Allah-Təala** (quru gəmisi kimi) **necə əcaib bir məxluq yaradıbdır?**

**(*Qeyd:** *Bu dörd şey (dəvə, səma, dağlar, yer) tövhid və ilahi qüdrətə dəlil və sübut olaraq hərçənd bütün islam ümmətinə şamildir. Lakin ərəblərə daha çox aiddir desək, daha doğru olar. Çünki ərəblər əksər ərazilərində, xüsusən Məkkə və Mədinə arasında və yenə Nəcd bölgəsində dəvədən, səmadan, dağ və yerdən başqa bir şey görməyiblər. Xüsusən dəvəyə minib, uca dağların arasında yol gedəndə, yuxarı baxanda səma və dağ görüb, aşağı baxanda dəvə və yeri görürdülər).*

**18) (وَاِلَى السَّمَاءِ كَيْفَ رُفِعَتْ) - Və səmaya baxmırlar ki, necə** (sonsuz) **ucalıb, sonu görünmür? Hər bir tərəfə baxanda həmin sonsuzluq görünər, onun sonunu düşünmək mümkün deyil.**

**19) (وَاِلَى الْجِبَالِ كَيْفَ نُصِبَتْ) - Bəs dağlara baxmırlar ki, yerə necə möhkəm dik basdırılıb, yox olmurlar?**

**20) (وَاِلَى الْاَرْضِ كَيْفَ سُطِحَتْ) - Bəs yerə baxmırlar ki, necə döşənib, hər bir həyat sahibindən ötrü məişət məskəni və sabitlik məqamı edilibdir? Bu şeylərin yaradılması Allah-Təalanın kamil qüdrətinə işarə etmirmi?**

**21-22) (فَذَكِّرْ اِنَّمَا اَنْتَ مُذَكِّرٌ لَسْتَ عَلَيْهِمْ بِمُصَيْطِرٍ)** - (Ey Məhəmməd), **müşriklər**

اِلَّا مَنْ تَوَلّٰى وَكَفَرَۙ ﴿٢٣﴾ فَيُعَذِّبُهُ اللّٰهُ الْعَذَابَ الْاَكْبَرَۜ ﴿٢٤﴾ اِنَّ اِلَيْنَٓا اِيَابَهُمْۙ ﴿٢٥﴾ ثُمَّ اِنَّ عَلَيْنَا
حِسَابَهُمْ ﴿٢٦﴾

---

**qeyd olunan dəlillərə baxan deyildirlər. Lakin sən nəsihətçi və vaiz olduğuna görə onlara öyüd-nəsihət edib, dəlil və sübutları onların yadına sal. Sənin işin ancaq öyüd- nəsihətdir. Daha onlara hakim deyilsən ki, zorla onları imana daxil edəsən. İman və imansızlıq onların öz ixtiyarlarına həvalə olunubdur.**

**23-24) (اِلَّا مَنْ تَوَلّٰى وَكَفَرَۙ فَيُعَذِّبُهُ اللّٰهُ الْعَذَابَ الْاَكْبَرَۜ) Lakin kim ki, islama daxil olmaqdan üz döndərib, kafir olsa Allah-Təala ona qalib olub, böyük əzab edəcəkdir.**

**25) (اِنَّ اِلَيْنَٓا اِيَابَهُمْۙ) Həqiqətən, ölüm onlara gəldikdən sonra qayıdacaqları yer hökmən bizim tərəfimizə olacaqdır.**

**26) (ثُمَّ اِنَّ عَلَيْنَا حِسَابَهُمْ) - Və bizim tərəfimizə qayıtmalarından sonra həqiqətən, onlarla haqq-hesab çəkmək ancaq bizə aiddir, bizdən başqa haqq-hesab çəkən olmaz. Haqq və ədalət üzrə haqq-hesab çəkib, hər bir şəxsin əməlinə görə ona qarşılıq verəcəyik.**

Allaha həmd olsun, əl-Ğaşiyə surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *“Kim əl-Ğaşiyə surəsini oxusa, Allah-Təala onun haqq-hesabını yüngül edər.”*

## əl-FƏCR SURƏSİ

89-cu surədir. Məkkədə nazil olub, 29 ayə, 139 kəlmə və 597 hərfdir.

وَالْفَجْرِۙ ﴿١﴾ وَلَيَالٍ عَشْرٍۙ ﴿٢﴾ وَالشَّفْعِ وَالْوَتْرِۙ ﴿٣﴾ وَالَّيْلِ اِذَا يَسْرِۚ ﴿٤﴾ هَلْ فٖي ذٰلِكَ قَسَمٌ لِذٖي
حِجْرٍۜ ﴿٥﴾ اَلَمْ تَرَ كَيْفَ فَعَلَ رَبُّكَ بِعَادٍۙ ﴿٦﴾ اِرَمَ ذَاتِ الْعِمَادِۙ ﴿٧﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1-2) (وَالْفَجْرِۙ)** - (Ey Məhəmməd**), and olsun sübh zamanına** (hansı ki, vaxtların ən yaxşısıdır)**, (وَلَيَالٍ عَشْرٍۙ) - və and olsun on gecəyə** (Zilhiccənin başından onuna kimi, hansı ki, gecələrin ən şərəflisidir).

**3) (وَالشَّفْعِ وَالْوَتْرِۙ) Və and olsun on gecənin cütünə** (ilk gecəyə) **və təkinə** (doqquzuncu gecəyə), **hansı ki, bu iki gecə on gecənin ən fəzilətliləridir.**

**4) (وَالَّيْلِ اِذَا يَسْرِۚ) Və and olsun hərəkət edib gedən gecəyə, hansı ki, gündüz daxil olur.** (Bu şeylərə and içirəm ki, əlbəttə, kafir və asilərə əzab edəcəm).

**5) (هَلْ فٖي ذٰلِكَ قَسَمٌ لِذٖي حِجْرٍۜ)** - (Ey Məhəmməd), **bu şeylərə and içməkdə ağıl sahiblərindən ötrü and içmək kifayət edər. Ya da and içmək istəyirlərsə, əlbəttə, ağıl sahiblərindən ötrü bu şeylərin birinə and içmək kifayət edər.**

**6-7) (اَلَمْ تَرَ كَيْفَ فَعَلَ رَبُّكَ بِعَادٍۙ اِرَمَ ذَاتِ الْعِمَادِۙ)** - (Ey Məhəmməd), **sənin rəbbin Allah-Təala əlbəttə asilərə əzab etməyə qadirdir. Bəs baxıb görmürsən ki,** (yəni eşitməyibsən? Əlbəttə, bizim verdiyimiz xəbəri eşidib bilirsən) **sənin rəbbin Allah-Təala* uca sütunlar sahibi olan birinci Ad** (İrəm) **camaatına necə əzab göndərib və necə onları həlak etdi?**

**(*Qeyd:** *Birinci Ad camaatı dünyanın ən qədim dövrlərində Yəmənə bağlı Mehrə adlı yerdə dəniz kənarında (hansı ki, indi oradan mirvari çıxarırlar) məskun idilər. Özləri qüvvətli, boy-buxunlu, güclü bədənə malik şəxslər idilər və bu səbəbdən böyük daşlardan uca sütunların üstündə uca imarətlər tikmişdilər. Bədənləri sağlam olduğuna görə ömürləri də uzun olurdu. Onlardan iki qardaş, biri Şədid, o birisi Şəddad – bu camaata sahib və sultan oldular. Şədid həlak olandan sonra Şəddad müstəqil sultan oldu. Ətraf bölgələrə də sahib olub, öz zəmanəsinin böyük sultanı idi. Gözəl qəsrlər və uca imarətlər tikib, axırda özü də, camaatı da tüğyan edib, küfr və şirkdə israr edib, Allah-Təalaya asi oldular. Allah-Təala ildırımdan hasil olan şiddətli göy gurultusunun səsi ilə onları həlak etdi, özlərindən bir müddət sonra qəsrləri də dağılıb, viran oldu. Birinci Ad ca-*

اَلَّتِي لَمْ يُخْلَقْ مِثْلُهَا فِي الْبِلَادِ ۙ ﴿٨﴾ وَثَمُودَ الَّذِينَ جَابُوا الصَّخْرَ بِالْوَادِ ۙ ﴿٩﴾ وَفِرْعَوْنَ ذِي
الْاَوْتَادِ ۙ ﴿١٠﴾ اَلَّذِينَ طَغَوْا فِي الْبِلَادِ ۙ ﴿١١﴾ فَاَكْثَرُوا فِيهَا الْفَسَادَ ۙ ﴿١٢﴾ فَصَبَّ عَلَيْهِمْ رَبُّكَ
سَوْطَ عَذَابٍ ۙ ﴿١٣﴾ اِنَّ رَبَّكَ لَبِالْمِرْصَادِ ۙ ﴿١٤﴾ فَاَمَّا الْاِنْسَانُ اِذَا مَا ابْتَلٰيهُ رَبُّهُ فَاَكْرَمَهُ وَنَعَّمَهُ
فَيَقُولُ رَبّٖٓي اَكْرَمَنِ ۙ ﴿١٥﴾

---

*maatının həqiqi qissəsi budur, müxtəsər şəkildə bəhs olundu. Amma təfsirçilər bu məqamda uzun-uzadı, xüsusən Şəddadın tikdirdiyi behişt barəsində təəccüblü, ağla zidd hekayələr nəql ediblər, hansı ki, qulaq onları eşitməkdən narahat olur. Mən həqir onların heç birini qeyd etməyə layiq görməyib, üz döndərdim və qələmi saxlayıb yazmadım. Əsli olmayan, yalan və iftira sözlərdən ibarətdir. Agah olmaq istəyənlər digər təfsir kitablarına baxsınlar).*

**8) (اَلَّتِي لَمْ يُخْلَقْ مِثْلُهَا فِي الْبِلَادِ) Elə imarətlər ki, dünyada olan şəhərlərdə onların bənzəri yaradılmamışdı, onlar Ad camaatına məxsus idi. Bununla belə Allah-Təala onları küfr və şirklərinə görə həlak edib, imarətlərini viran etdi.**

**9) (وَثَمُودَ الَّذِينَ جَابُوا الصَّخْرَ بِالْوَادِ)** - (Ey Məhəmməd), **yenə Səmud camaatının əhvalatına agah ol ki,** (Qura vadisi) **adlı yerdə daşları kəsib, böyük daş parçalarından evlər tikdilər. Bədənlərinin qüvvəti belə idi. Bununla belə Allah-Təala onların hamısını həlak etdi.** (Məskənləri Şamla Mədinə arasında olub, müsafirlərdən ötrü bir ibrətdir).

**10) (وَفِرْعَوْنَ ذِي الْاَوْتَادِ) Yenə Allah-Təala çoxlu paya** (dirək) **sahibi olan firona və qoşununa əzab göndərdi.** (Çoxlu dirəklər fironun qoşununun çoxluğuna işarədir. Qoşuna lazım olan çadırların çoxluğundan çadırların saysız-hesabsız dirəkləri var idi).

**11) (اَلَّذِينَ طَغَوْا فِي الْبِلَادِ) Firon və onun qoşunu** (Misir) **şəhərlərində tüğyan etdilər.**

**12) (فَاَكْثَرُوا فِيهَا الْفَسَادَ) - O şəhərlərdə qanlar töküb, Bəni-İsrailə zülm edib, çox fəsadlar etdilər.**

**13) (فَصَبَّ عَلَيْهِمْ رَبُّكَ سَوْطَ عَذَابٍ)** - (Ey Məhəmməd), **onların fəsadlarına görə sənin rəbbin Allah-Təala onların üzərinə əzab qamçısını endirib, hamısını dənizdə qərq etdi.** (Allah-Təalanın müxtəlif əzab qamçıları vardır. O cümlədən biri də dənizdə qərq etməkdir).

**14) (اِنَّ رَبَّكَ لَبِالْمِرْصَادِ)** - (Ey Məhəmməd), **həqiqətən, sənin rəbbin Allah-Təala bəndələrinin əməllərini gözətləyib, onların əməllərindən heç bir şey Allah-Təalanın nəzərindən qaçmayıb, xeyir əmələ mükafat, şər əmələ cəza verəcəkdir.**

**15) (فَاَمَّا الْاِنْسَانُ اِذَا مَا ابْتَلٰيهُ رَبُّهُ فَاَكْرَمَهُ وَنَعَّمَهُ) Allah-Təala bəndələrinin itaət və ibadət etmələrini istəyir, asilərə əzab edəcəkdir. Lakin nə zaman ki, insa-**

وَاَمَّآ اِذَا مَا ابْتَلٰيهُ فَقَدَرَ عَلَيْهِ رِزْقَهُ فَيَقُولُ رَبّٖٓي اَهَانَنِۚ ﴿١٦﴾ كَلَّا بَلْ لَا تُكْرِمُونَ الْيَتٖيمَۙ ﴿١٧﴾

---

**na rəbbi Allah-Təala bol nemət verərək, imtahan edib, əziz və hörmətli etsə, (فَيَقُولُ رَبّٖٓي اَكْرَمَنِۜ) - O vaxt insan Allah-Təalanın mərhəmət və lütfünü yadından çıxarıb deyər: “Allah-Təalanın nemətlərinə layiq olduğuma görə bu nemətləri Allah-Təala mənə verib, məni əziz və hörmətli etdi. Belə sözlər deyib, Allah-Təalaya şükür etməyi yaddan çıxarar.**

**16) (وَاَمَّآ اِذَا مَا ابْتَلٰيهُ فَقَدَرَ عَلَيْهِ رِزْقَهُ) Amma o zaman ki, insanı - görəsən səbir edəcək, yoxsa şikayət edəcək deyə imtahan edib, ruzisini azaldıb, yoxsullaşdırsa, (فَيَقُولُ رَبّٖٓي اَهَانَنِۚ) o vaxt insan səbir etməyib deyər: rəbbim Allah-Təala məni yoxsullaşdırmaqla həqir və zəlil etdi.** (İnsanın xüsusiyyəti belədir, nemətə şükür, yoxsulluğa səbir etməz).

**17) (كَلَّا بَلْ لَا تُكْرِمُونَ الْيَتٖيمَۙ) Gərək nemət və ya yoxsulluq halında siz insanlar səbir edib, Allah-Təalaya şükür edib, belə sözləri deməyəsiniz. Lakin belə sözləri deməkdən başqa qəbih və şər əməlləriniz də var. Harada* yetim uşaq görsəniz, gərək onlara qulluq edib, bizim əmanətimizi zay etməyəsiniz. Amma siz heç bir şəkildə yetimin halını düşünməyib, islamın haqqını qorumayıb, yetimin halından xəbərdar olmayıb, ona qulluq, xidmət etmirsiniz.**

**(*Qeyd:** *Yetimlərin və yoxsulların əhvalını araşdırmaq və düşünmək baxımından Qurani-Şərifdə başqa bir ayə olmasa belə bu iki ayə kifayət etməzmi? Halbuki bunlardan başqa yetim və yoxsullar haqqında yüzlərlə belə ayələr Qurani-Şərifdə nazil olub.*

*Bizim varlılarımız isə sanki Quranın ehkamından birdəfəlik bixəbər qalıblar. Bixəbər olsalar da, insaf, mürüvvət və insanlığa nə deyirlər? Görəsən, xəzinələrini doldurub, gecə-gündüz mal toplamağa çalışıb, kasıbların və yetimlərin əhvalından xəbərdar olmamaq insanlığa layiq sifətdirmi? Ayələrin açıq-aşkar işarəsi ilə yetim və yoxsullar Allah-Təalanın bizə olan əmanəti hesab olunurlar. Onları unutmaq Allah-Təalanın əmanətinə xəyanət etməkdir. Görəsən, xain şəxsə Allah-Təala necə qəzəblənib, əzab edəcəkdir? Ayələrə görə yetim və yoxsullardan ötrü yetimlər və qocalar evi tikib, onların hər bir problemini araşdırmaq, onlardan ötrü mehriban ata-analar kimi mürəbbilər təyin edib, onların küçə və bazarlarda sərgərdan dolanmasına razı olmamaq islamın ən vacib əmrlərindəndir. Digər millətlər bu ayələrin ehkamını bizdən öyrənib, böyük şərəfə nail olublar. İslam ümməti Qurani-Kərimin ayələrindən üz döndərdiyi üçün cahil və vəhşi nadanlar kimi elm və mədəniyyətdən uzaqlıqda digər millətlərin nəzərində zərb-məsəl olublar və haqları da vardır. Gərək islam ümmətinin varlıları ittifaq edib, belə işlərə əncam çəkib, nifaq, xudbinlik, təkəbbür kimi sifətləri özlərindən kənar edib, insanlıq aləminə qədəm qoyub, Quran əhli hesab olunsunlar, yoxsa özlərinə*

*müsəlman, Quran əhli dемələri xətadır. Əks təqdirdə ar olsun bizə ki, varlığımızla islamı, Quranı inkar etmiş olub və islamın əzəmətini dağıdıb, gözəlliyini pozuruq. Nə gözəl deyir şair: farsca ifadə İslam ümməti ittifaq edib, müxtəlif rəy sahiblərinin rəylərini və müftilərin müxtəlif fətvalarını tərk edib, bir kənara qoyub, bütünlüklə ancaq Qurani-Şərifə sarılıb, birlik içində olsalar nə yaxşı olar. O vaxt şübhəsiz ki, islamın ilk dövrlərində olan əzəmət və qüdrətləri yenidən onlara qayıdar. Təəccüblü budur ki, deyirlər: "Sadəcə Quranla hərəkət etmək mümkün olmaz. Cavab: "Görəsən, peyğəmbərin və "raşid" xəlifələrin zamanında Qurani-Şərifdən başqa əllərində nə var idi? Əgər desən ki, peyğəmbər Qurani-Şərifdən əlavə də ehkamlar verib, cavab verərik: "Peyğəmbərin fərmanları eyni Quran kimidir. Qurani-Şərifin hökmüylə gərək peyğəmbərin fərmanlarına tabe olaq. Raşid xəlifələrin zamanında peyğəmbərin fərmanları yox idi, bəs niyə onların arasında heç bir ehkamda ixtilaf olmayıb? Heç kim özündən rəy vermirdi. Çünki Qurani-Şərifin və peyğəmbərin ehkamları hamısı məlum idi, dəyişdirilmədən hamısına əməl olunurdu. Bu ixtilaflar peyğəmbərdən xeyli sonra meydana gəldi. Bəs bu ixtilafları yox edib, islamı daha öncə olduğu kimi möhkəmlətmək mümkün deyilmi? Əlbəttə, mümkündür. İndi zəmanə dəyişib, insanlar getdikcə daha çox şeyə agah olub, elm öyrənməyə çalışırlar. Alim şəxslərə tövsiyə edirəm ki, mən həqirin bu mətləbini anlayıb, yaysınlar. Gərək islam ümməti bir məzhəbdə birləşib, Qurani-Şərifin və peyğəmbərin ehkamını əsas götürüb, peyğəmbərin xəbər verdiyi kimi "firqeyi-naciyə" -"qurtulmuş qrup" olsunlar. Həmin hədisin vaxtı gəlibdir. Gərək "firqeyi-naciyə" baş qaldırıb, müsəlmanların içində olan digər firqələri yox edib, islamın bayrağını ucaltsın. Eyni vaxtda bir şəhərdə yüzə qədər müfti və rəy sahibi olub hər biri özbaşına bir fətva verib, risalələrin kənarlarına haşiyə yazıb, "bu işi ehtiyatla qarşılayın" və ya "ya ehtiyatı tərk edin, ya da mən həqirin rəyini qəbul edin" , "bu, dəstəmaz suyunun pisliyi, ya da təmizliyi haqqındadır" və ya "üzüm şirəsi nəcisdir, yoxsa yox?", ya da "cinsiyyət orqanı kəsik olanın hökmü nədir?" kimi ibarələr yazıb, bu xurafatlarıyla mən alimlər alimiyəm, məni təqlid etmək vacibdir, deyib camaatı özlərinə cəlb edib, islamı neçə qrupa parçalayıblar. Dəstəmaz suyu pak, yoxsa nəcisdir? Və ya kişmiş haram, yoxsa halaldır? - kimi məsələlərlə ana oğlunu, oğul atasını nəcis elan edib, bir-birlərindən qaçırlar. Ya da ki, dörd məzhəbin davamçılarının bir-birlərini xətalı, təkcə özünü haqq sayması islam şəriətinə uyğundurmu? Ey islam ümməti, vay olsun sizə, görəsən, o vaxt gəlməyib ki, özünüzü bu ovçuların kəməndindən və torundan xilas etməkdən ötrü bir çarə axtarıb, Qurani-Şərifin ehkamının yayılmasına çalışıb, müxtəlif adları rədd edib, müsəlman və Quran əhli adı altında birləşib, islamın ilk dövrlərində uyğulanan islam qanunlarına əməl edib yayasınız? İndi bu dövrdə dünyanın hər bir tərəfində müsəlmanların işlərindən ötrü məclislər və xeyriyyə qurumları yaradılıb, onların əskikliklərini islah etmək üçün işlər görülür. Bəs olmazmı ki, islam ölkələrinin hər bir mərkəzi bölgəsində də islamın içindəki ixtilafların kökünü kəsib, müsəlmanları bir məzhəbdə birləşdirmək üçün "qal`ül-ixtilaf an dinil-is-*

وَلَا تَحَٓاضُّونَ عَلٰى طَعَامِ الْمِسْكِينِۙ ﴿١٨﴾ وَتَأْكُلُونَ التُّرَاثَ اَكْلًا لَمًّاۙ ﴿١٩﴾ وَتُحِبُّونَ الْمَالَ حُبًّا
جَمًّاۜ ﴿٢٠﴾ كَلَّا اِذَا دُكَّتِ الْاَرْضُ دَكًّا دَكًّاۙ ﴿٢١﴾ وَجَٓاءَ رَبُّكَ وَالْمَلَكُ صَفًّا صَفًّاۚ ﴿٢٢﴾ وَج۪يٓءَ
يَوْمَئِذٍ بِجَهَنَّمَ يَوْمَئِذٍ يَتَذَكَّرُ الْاِنْسَانُ وَاَنّٰى لَهُ الذِّكْرٰىۜ ﴿٢٣﴾

---

*lam" ("islam dinindən ixtilafı yox etmək") adı ilə məclislər təşkil edilsin və islam rəvac tapsın? Əlbəttə olar, lakin qeyrət və çalışmaq lazımdır. Ah, içəridən və kənardan vurulan zərbələrdən islam zəifləyib, tənəzzül edib, ulduz kimi çırağı sönüb, islam ümməti zəlalət vadisində kor-koranə, sərgərdan qalıb, nicat yolunu tapa bilmir. Mədəd, ya möhtaclara yardım edən!)*

**18) (وَلَا تَحَٓاضُّونَ عَلٰى طَعَامِ الْمِسْكِينِۙ) - Özünüz yoxsullara yemək vermədiyiniz kimi başqalarını da onlara yemək verib, yaxşılıq etməyə həvəsləndirmirsiniz. Özünüz yoxsulun halına qalmaqla birlikdə, bir-birinizi də buna həvəsləndirmək lazımdır. Əks təqdirdə bundan şər və xəbis əməl varmı?**

**19) (وَتَأْكُلُونَ التُّرَاثَ اَكْلًا لَمًّاۙ) Qohum-əqrəbadan qalan mirası, başqaların payını da özünüz yığıb, halalı harama qatıb yeyirsiniz.** (Qadınlara, uşaqlara mirasdan pay verməyib, onların malını yeyirdilər. Necə ki, bu zamanda da yeyirlər).

**20) (وَتُحِبُّونَ الْمَالَ حُبًّا جَمًّاۜ) - Dünya malını lap çox istəyib, vacib haqqı** (zəkatı) **vermirsiniz.**

**21) (كَلَّا) - Məhşər günündə ilahi əzabdan qorxub, belə əməlləri tərk edin. (اِذَا دُكَّتِ الْاَرْضُ دَكًّا دَكًّاۙ) - O zaman ki,** (qiyamət günündə) **bir-birinin dalınca zəlzələ olub, yer dağılıb parça-parça olacaq,**

**22) (وَجَٓاءَ رَبُّكَ وَالْمَلَكُ صَفًّا صَفًّاۚ)** - (Ey Məhəmməd), **mələklər səf-səf durduqları halda sənin rəbbin Allah-Təala gəlib, insanları böyük qorxu tutanda,** (gəlmək feili hər hansı bir yöndə olan cismə məxsusdur. Allah-Təala cism və yöndən uzaq və pak olduğuna görə ayədə Allah-Təalanın qüdrət və hakimiyyəti və əzəmətinin zühurundan ötrü məsəl çəkilir. Necə ki, əzəmətli bir sultan camaatın arasına çıxanda, xalq necə qorxub, dəhşətə gələrsə, habelə qiyamət günündə sanki Allah-Təala öz müqəddəs zatı ilə camaatın arasına gəlmiş kimi onun qüdrət və əzəmətindən camaatı qorxu bürüyər).

**23) (وَج۪يٓءَ يَوْمَئِذٍ بِجَهَنَّمَ يَوْمَئِذٍ يَتَذَكَّرُ الْاِنْسَانُ وَاَنّٰى لَهُ الذِّكْرٰىۜ) Qiyamət günündə cəhənnəm gətirilər.** (Yəni səmalardan zühur edər), **ogünkü gündə elə ki, cəhənnəm zühur edib, əzab olacağı qəti bilindi, o zaman insan xatırlayacaq ki, eyvah, əzab var imiş. Kaş ki, mən dünyada xeyir əməl edəydim. Amma** (Ey Məhəmməd), **qiyamət günündə xatırlamaq ona nə fayda verər? Təklif qurtarıb, tamam olub, axirət cəza aləmidir.**

يَقُولُ يَا لَيْتَنِي قَدَّمْتُ لِحَيَاتِي ﴿٢٤﴾ فَيَوْمَئِذٍ لَا يُعَذِّبُ عَذَابَهُ اَحَدٌ ﴿٢٥﴾ وَلَا يُوثِقُ وَثَاقَهُ اَحَدٌ
﴿٢٦﴾ يَآ اَيَّتُهَا النَّفْسُ الْمُطْمَئِنَّةُ ﴿٢٧﴾ اِرْجِعِي اِلٰى رَبِّكِ رَاضِيَةً مَرْضِيَّةً ﴿٢٨﴾ فَادْخُلِي فِي
عِبَادِي ﴿٢٩﴾ وَادْخُلِي جَنَّتِي ﴿٣٠﴾

---

**24) (يَقُولُ يَا لَيْتَنِي قَدَّمْتُ لِحَيَاتِي) - Cəhənnəmi görəndə insan təəssüf edib deyər: "Kaş ki, bu axirət üçün, əbədi həyatımdan ötrü xeyir əməllər göndərmiş olaydım ki, bu günkü gündə mənə fayda verəydi.** (Bu peşmanlıq insana axirətdə fayda verməz).

**25) (فَيَوْمَئِذٍ لَا يُعَذِّبُ عَذَابَهُ اَحَدٌ) Qiyamət günündə Allah-Təalanın edəcəyi əzabı heç kim etməyə qadir deyildir. Hər bir iş sadəcə Allah-Təalaya həvalə edilər. Əzab, yoxsa savab vermək Ona aiddir.**

**26) (وَلَا يُوثِقُ وَثَاقَهُ اَحَدٌ) Və heç kim asiləri Allah-Təalanın zəncirlə bağlaması kimi bağlaya bilməz.**

**27) (يَآ اَيَّتُهَا النَّفْسُ الْمُطْمَئِنَّةُ)** - (Ey Məhəmməd), **qiyamət günündə insanlar son dərəcə qorxu içində olduqları halda bizim tərəfimizdən möminlərə xitab olunub deyilər: "Ey hər bir qorxu və hüzndən xatircəm olub, əzabdan amanda olan şəxs,**

**28) (اِرْجِعِي اِلٰى رَبِّكِ رَاضِيَةً مَرْضِيَّةً) Allah-Təala səndən razı, sən də Allah-Təalanın nemətlərindən razı olduğun halda rəbbin Allah-Təalanın sənə vəd etdiyi cənnətə dön.**

**29-30) (فَادْخُلِي فِي عِبَادِي وَادْخُلِي جَنَّتِي) - Mənim saleh bəndələrimin arasına daxil olub, onlarla birlikdə mənim cənnətimə gir.**

Allaha həmd olsun, əl-Fəcr surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim əl-Fəcr surəsini Zilhiccənin ilk on gecəsi oxusa, Allah-Təala onu bağışlayar. Digər gecələrdə oxuyan şəxslərdən ötrü də qiyamət günündə bir nur olar."*

## əl-BƏLƏD SURƏSİ

90-cı surədir. Məkkədə nazil olub, 20 ayə, 82 kəlmə və 320 hərfdir.

لَآ اُقْسِمُ بِهٰذَا الْبَلَدِۙ ﴿١﴾ وَاَنْتَ حِلٌّ بِهٰذَا الْبَلَدِۙ ﴿٢﴾ وَوَالِدٍ وَمَا وَلَدَۙ ﴿٣﴾ لَقَدْ خَلَقْنَا الْاِنْسَانَ فٖي
كَبَدٍؕ ﴿٤﴾ اَيَحْسَبُ اَنْ لَنْ يَقْدِرَ عَلَيْهِ اَحَدٌۢ ﴿٥﴾ يَقُولُ اَهْلَكْتُ مَالًا لُبَدًاؕ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (لَآ اُقْسِمُ بِهٰذَا الْبَلَدِۙ) Kafirlər və müşriklər zənn edirlər ki, axirətdə onlara heç bir zərər dəyməyib, məşəqqətə düçar olmayacaqlar. Elə deyil. And içirəm bu Məkkə şəhərinə,**

**2)* (وَاَنْتَ حِلٌّ بِهٰذَا الْبَلَدِۙ) Hansı ki,** (Ey Məhəmməd), **sən bu Məkkədən qovulandan sonra yenə bu şəhərə gəlib, ona sahib olub, Qüreyş camaatı sənin əlində zəlil və zəif olacaqlar.**

**(*Qeyd:** *Bu ayə andla and içilən şeyin arasında mötərizə içində vaqe olubdur. Məkkə əhli peyğəmbərə əziyyət edib, o cənabı ya qətl etmək, ya da Məkkədən qovmaq fikrində olduqlarından Allah-Təala bu ayə ilə peyğəmbərin yenidən Məkkəyə qayıdıb, əmr və qadağa sahibi olacağını xəbər verir. Belə ki, o cənab təsəlli tapıb, müşriklərin əziyyət və əzablarına səbir etsin).*

**3) (وَوَالِدٍ وَمَا وَلَدَ) Və and olsun ataya** (İbrahimə) **və doğuzdurduğu oğula,** (sənə ey Məhəmməd, sən ki, İbrahimin oğlusan).

**4) (لَقَدْ خَلَقْنَا الْاِنْسَانَ فٖي كَبَدٍؕ) - Bu şeylərə and içirəm ki, həqiqətən, biz insanı dünya və axirətdə zəhmət və məşəqqət içində yaratmışıq. Dünyada məişət dərdindən həmişə məşəqqətdə olar. Əgər Allah-Təalaya asi olsalar, əlbəttə axirətdə də məşəqqət və əzab içində olacaqlar. İnsan bizə asi olub, axirət əzabını inkar etməsin.**

**5) (اَيَحْسَبُ اَنْ لَنْ يَقْدِرَ عَلَيْهِ اَحَدٌۢ)** - (Ey Məhəmməd), **bəlkə Allah-Təalaya asi olan insan elə zənn edir ki, heç bir nəfər, hətta Allah-Təala da ona əzab etməyə qadir olmayacaqdır.**

**6) (يَقُولُ اَهْلَكْتُ مَالًا لُبَدًاؕ) Elə ki qiyamət oldu, bizə asi olan insan baxıb görəndə ki, biz ona hakim olub, əzab etməyə qadirik və dünyada riya yolu ilə sərf etdiyi malları ona heç bir fayda vermir, o vaxt deyəcəkdir: xeyli malı cahilcəsinə, iftixar etmək üçün riya yolu ilə sərf edib, zay etdim. Bu günkü gündə o mallar mənə fayda vermədi.**

اَيَحْسَبُ اَنْ لَمْ يَرَهُ اَحَدٌ ﴿٧﴾ اَلَمْ نَجْعَلْ لَهُ عَيْنَيْنِ ﴿٨﴾ وَلِسَانًا وَشَفَتَيْنِ ﴿٩﴾ وَهَدَيْنَاهُ النَّجْدَيْنِ
﴿١٠﴾ فَلَا اقْتَحَمَ الْعَقَبَةَ ﴿١١﴾ وَمَآ اَدْرٰيكَ مَا الْعَقَبَةُ ﴿١٢﴾ فَكُّ رَقَبَةٍ ﴿١٣﴾

---

**7) (اَيَحْسَبُ اَنْ لَمْ يَرَهُ اَحَدٌ)** - (Ey Məhəmməd), **bu insan ki, dünya malını iftixar və riya etmək üçün sərf edir, hansı ki, axirətdə ondan ötrü əzab-əziyyət olacaqdır, bəlkə elə zənn edir ki, heç bir nəfər, hətta Allah-Təala da onu görməyib, onun qəlbinin sirrinə agah deyil. Lakin biz onun bütün əməllərini görüb, sirlərinə agah olub, əməllərinə münasib ona cəza verəcəyik.**

**8) (اَلَمْ نَجْعَلْ لَهُ عَيْنَيْنِ) - Bu insan ki, malını riya və iftixar etmək üçün sərf edir, bəs bu insandan ötrü biz iki* göz yaradıb verməmişik ki, görünən aləmi hər iki tərəfdən olduğu kimi dərk etsin?**

**(*Qeyd:** *"Allah-Təalanın insana və digər heyvanlara iki göz verməsi ondan ötrü deyildir ki, biri olmayanda o birisi ona kifayət edib, məişətini onunla təmin etsin. Əksinə, o səbəbədir ki, cismi iki gözlə hər iki tərəfdən görüb dürüst, olduğu kimi tamam görsün).*

**9) (وَلِسَانًا وَشَفَتَيْنِ) Yenə insandan ötrü qəlbinin istəklərinə mütərcim olan bir dil və danışmasına, yeyib-içməsinə vasitə olan iki dodaq yaradıb, verməmişikmi?**

**10) (وَهَدَيْنَاهُ النَّجْدَيْنِ) - Bu nemətləri insana verib, xeyir və şər yoluna onu hidayət etdik və onların hər birini seçməkdə insanı azad, ixtiyar sahibi etdik. Heç bir şəkildə onu məcbur etmədik.**

**11) (فَلَا اقْتَحَمَ الْعَقَبَةَ) Amma insan nəfsinə müxalif olub, nəfsani arzularını tərk, nəfsinə qarşı cihad etməyib, saleh əməllərə yönəlmədi.**

**12) (وَمَآ اَدْرٰيكَ مَا الْعَقَبَةُ)** - (Ey Məhəmməd), **"əqəbə"nin** (təhlükəli keçid, dağ cığırı) **nə olduğunu sən nə bilirsən? Gərək biz sənə bildirək. Bundan sonra qeyd olunanlar "əqəbə"ni izah edir.**

**13) (فَكُّ رَقَبَةٍ) "Əqəbə"dən məqsəd öncə qulam* və kənizləri alıb, köləlikdən azad etməkdir.** (Xeyir əməllərin ilki qulam və kənizi azad etməkdir).

**(*Qeyd:** *O şəxslər ki, qulam, kəniz barəsində islama tənə edib, qulam və kəniz etməyə izin verilməsini eyib sayır, bu ayəyə baxıb, ibrət alsınlar ki, xeyir əməllərin ilki onları alıb, köləlikdən azad etməkdir. Doğrudur, cihad zamanı kafir və müşriklərdən əsir düşənlərin qulam və kəniz edilməsinə islam dini izin verir. Lakin bu, siyasi bir əmrdir. Siyasi əmrə kənar şəxslərin müdaxilə etməyə haqqı yoxdur. Bununla belə cihad qurtarıb, əsirlərə sahib olandan sonra Qurani-Şərifdə və hədislərdə onları köləlikdən xilas etməkdən ötrü əcr və savab bəyan olunub*

اَوْ اِطْعَامٌ فٖي يَوْمٍ ذٖي مَسْغَبَةٍۙ ﴿١٤﴾ يَتٖيمًا ذَا مَقْرَبَةٍۙ ﴿١٥﴾ اَوْ مِسْكٖينًا ذَا مَتْرَبَةٍؕ ﴿١٦﴾ ثُمَّ كَانَ مِنَ الَّذٖينَ اٰمَنُوا وَتَوَاصَوْا بِالصَّبْرِ وَتَوَاصَوْا بِالْمَرْحَمَةِؕ ﴿١٧﴾ اُو۬لٰٓئِكَ اَصْحَابُ الْمَيْمَنَةِؕ ﴿١٨﴾ وَالَّذٖينَ كَفَرُوا بِاٰيَاتِنَا هُمْ اَصْحَابُ الْمَشْـَٔمَةِؕ ﴿١٩﴾ عَلَيْهِمْ نَارٌ مُؤْصَدَةٌ ﴿٢٠﴾

---

*və təşviq edilib. Həqiqətən, kölələrə malik olmaq işi siyasi bir məsələdir. Qulam, kəniz almağa keçmiş peyğəmbərlərin şəriətində də izin verilsə də, lakin heç birində onları azad etməyə islam şəriətindəki kimi təkid edilməyib və bu səbəbdən günahlara "kəffarə" vermək üçün hər şeydən öncə "kölə azad" etmək qeyd olunubdur. Habelə Ramazan ayında və digər mübarək günlərdə cüzi bəhanələrlə də olsa kölə azad etmək əmr edilibdir. Belə olan halda islama irad tutub, köləliyi islamın əsası saymaq insaf və mürüvvətdən kənar olan bir nadanlıqdır).*

**14) (اَوْ اِطْعَامٌ فٖي يَوْمٍ ذٖي مَسْغَبَةٍۙ)** (İkincisi) **- aclıq günündə yemək verməkdir. Kimə yemək verilməlidir, bundan sonra bəyan edilir.**

**15) (يَتٖيمًا ذَا مَقْرَبَةٍۙ) Qohumluq əlaqəsi çatan bir yetimə,**

**16) (اَوْ مِسْكٖينًا ذَا مَتْرَبَةٍؕ) Ya da ki, torpağa yapışıb, heç bir şeyə malik olmayan yoxsula yemək verilsin.** (Yəni bu iki növ möhtaca yemək vermək ən vacib əmrdir, bunlardan başqalarına və müsəlmanların xeyri üçün mal sərf etmək də əlbəttə gözəl bir işdir).

**17) (ثُمَّ كَانَ مِنَ الَّذٖينَ اٰمَنُوا وَتَوَاصَوْا بِالصَّبْرِ وَتَوَاصَوْا بِالْمَرْحَمَةِؕ) - Bu xeyir əməllərə yönəlməklə birlikdə gərək mömin şəxslərdən olub, bir-birlərini itaət və ibadətə təşviq edib, günahı tərk edib, səbir etməyi, bir-birilərinə mərhəmət və yardım etməyi vəsiyyət etsinlər.** (Belə iman olandan sonra yuxarıda qeyd olunan əməllər fayda verər, yoxsa bir fayda verməz).

**18) (اُو۬لٰٓئِكَ اَصْحَابُ الْمَيْمَنَةِؕ)** - (Ey Məhəmməd), **qiyamət günündə sağ tərəfin əhli** (xoşbəxtlik əhli) **belə şəxslər olacaqdır.**

**19) (وَالَّذٖينَ كَفَرُوا بِاٰيَاتِنَا هُمْ اَصْحَابُ الْمَشْـَٔمَةِؕ)** - (Ey Məhəmməd), **o şəxslər ki, bizim ayələrimizə** (Qurani-Şərifə) **kafir olub, onu qəbul etmədilər, sol tərəfin əhli** (əzab əhli) **olacaqlar.**

**20) (عَلَيْهِمْ نَارٌ مُؤْصَدَةٌ ) - Onları hər bir tərəfdən əhatə edib, ortada tutan bir od onlara hakim olub, əzab içində olacaqlar.**

Allaha həmd olsun, əl-Bələd surəsinin təfsiri tamamlandı. Peyğəmbər (ə.s) buyurdu: *"Kim əl-Bələd surəsini oxusa, Allah-Təala qiyamət günündə öz qəzəbindən ona əmin-amanlıq verər."*

## əş-ŞƏMS SURƏSİ

91-ci surədir. Məkkədə nazil olub, 15 ayə, 54 kəlmə və 247 hərfdir.

وَالشَّمْسِ وَضُحٰيهَا ۙ ﴿١﴾ وَالْقَمَرِ اِذَا تَلٰيهَا ۙ ﴿٢﴾ وَالنَّهَارِ اِذَا جَلّٰيهَا ۙ ﴿٣﴾ وَالَّيْلِ اِذَا يَغْشٰيهَا ۙ
﴿٤﴾ وَالسَّمَآءِ وَمَا بَنٰيهَا ۙ ﴿٥﴾ وَالْاَرْضِ وَمَا طَحٰيهَا ۙ ﴿٦﴾ وَنَفْسٍ وَمَا سَوّٰيهَا ۙ ﴿٧﴾ فَاَلْهَمَهَا
فُجُورَهَا وَتَقْوٰيهَا ۙ ﴿٨﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (وَالشَّمْسِ وَضُحٰيهَا ۙ) And olsun günəşə və onun yer üzünə yayılan mükəmməl işığına,**

**2) (وَالْقَمَرِ اِذَا تَلٰيهَا ۙ) və and olsun o aya ki, günəş batarkən ondan nur alıb, hilal şəklində onun arxasınca zühur edər.**

**3) (وَالنَّهَارِ اِذَا جَلّٰيهَا ۙ) Və and olsun o gündüzə ki, günəşi cilvələndirib, zahir edər.***

(***Qeyd:** *"Gündüz günəşin təcəlli edib, zahir olub doğmasından ibarətdir. Lakin ayədə günəşin təcəlli və zühur etməsinin gündüzə isnad edilməsi bu günkü gündə bütün Avropa alimləri tərəfindən də qəbul edilən mətləbə işarədir. O mətləb budur, yer də digər ulduzlar kimi bir planet olub, gecə-gündüz iyirmi dörd saat içində öz oxu ətrafında hərəkət edər. Ayədən anlaşılan məna belədir ki, yer öz oxu ətrafında hərəkət etməklə özündə məskun olan məxluqatdan ötrü dünyanın hər bir tərəfində daim günəşin doğmasına səbəb olur. Günəşin təcəlli və zühur etməsi yerin öz oxu ətrafındakı hərəkətindən asılı olduğundan gündüzə isnad edildi, yoxsa qədim astronomlara görə gündüzün təcəlli və zühur etməsini günəşin doğmasına isnad edilirdi. Əgər ayələrdəki dərin mənalara diqqət edilsə, onun bütün elmləri ehtiva etdiyini görüb, belə elmləri başqalarından öyrənməmizlə iftixar etməmizdən xəcalət çəkməliyik. Qurani-Şərif elmi, siyasi, hüquqi, müqəddəs bir kitabdır. Heyf ki, biz Quran əhli ondan istifadə etməyib, əksinə əməllərimizlə belə bir kitabı digər millətlərin nəzərində maarifə və mədəniyyətə zidd bir kitab kimi göstərmişik. Ar olsun bizə!)*

**4) (وَالَّيْلِ اِذَا يَغْشٰيهَا ۙ) Və and olsun o gecəyə ki, onun zülməti günəşin nurunu örtüb, üfüqü qaranlıq edər.**

**5-6-7-8) (وَالسَّمَآءِ وَمَا بَنٰيهَا ۙ وَالْاَرْضِ وَمَا طَحٰيهَا ۙ وَنَفْسٍ وَمَا سَوّٰيهَا ۙ) Göyə və yerə və hər bir nəfsə və səmanı yaradıb, yeri geniş şəkildə döşəyən və hər bir nəfsi yaradan tanrıya and olsun ki, bu Məkkəli Qüreyş camaatına peyğəmbərimi**

قَدْ اَفْلَحَ مَنْ زَكّٰيهَاۖ ﴿٩﴾ وَقَدْ خَابَ مَنْ دَسّٰيهَاۜ ﴿١٠﴾ كَذَّبَتْ ثَمُودُ بِطَغْوٰيهَاۖ ﴿١١﴾ اِذِ انْبَعَثَ اَشْقٰيهَاۖ ﴿١٢﴾ فَقَالَ لَهُمْ رَسُولُ اللّٰهِ نَاقَةَ اللّٰهِ وَسُقْيٰيهَاۜ ﴿١٣﴾ فَكَذَّبُوهُ فَعَقَرُوهَاۖ فَدَمْدَمَ عَلَيْهِمْ رَبُّهُمْ بِذَنْبِهِمْ فَسَوّٰيهَاۖ ﴿١٤﴾

---

(Məhəmmədi) **təkzib etdikləri üçün Səmud camaatına etdiyim əzab kimi əzab göndərib, həlak edib, darmadağın edəcəm. Necə ki, Bədir savaşında Qüreyş camaatını elə dağıtdı ki, bir də özlərinə gələ bilmədilər.** (فَاَلْهَمَهَا فُجُورَهَا وَتَقْوٰيهَاۙ ) **Allah-Təala hər bir kəsi yaradıb günah və təqva, şər və xeyir yolunu** (ona ağıl verməklə) **ona ilham edibdir. Hər bir xeyir və ya şər əməl etsə, öz arzu və iradəsi ilə edib, qarşılığını görəcəkdir.**

**9)** (قَدْ اَفْلَحَ مَنْ زَكّٰيهَاۙ) **Xeyir və şərin ixtiyarı insanın özündədir, ağla tabe olub, təqvalı olsa, xəbis əməllərdən və rəzil xüsusiyyətlərdən çəkinib, nəfsini bunlardan uca tutsa, elm öyrənməyə çalışsa, həqiqətən belə şəxs dünya və axirətdə əcr və savaba çatıb, kamil insan olar.**

**10)** (وَقَدْ خَابَ مَنْ دَسّٰيهَاۜ) **Və kim ki, xəbis əməllərə qurşanıb, nəfsini rəzil sifətlərə sahib edib, digər nəfislər arasında nəfsini alçaldıb, heç bir elm öyrənməsə, həqiqətən, belə şəxs özünə ziyan vurub, dünya və axirətdə məhv olub, bir fayda əldə etməyəcəkdir.**

**11)** (كَذَّبَتْ ثَمُودُ بِطَغْوٰيهَاۙ) - (Ey Məhəmməd), **necə ki, Məkkəli Qüreyş camaatı səni təkzib edirlər, habelə Səmud camaatı da küfr və tüğyanları ilə peyğəmbərlərini** (Salehi) **təkzib etdilər.**

**12)** (اِذِ انْبَعَثَ اَشْقٰيهَاۙ) **Təkzib etməklə kifayət etməyib, onlardan ötrü möcüzə olan dəvəni öldürmək üçün o camaatın ən asisi** (Qudarə ibn Salif) **sürətlə qalxıb hazır oldu.**

**13)** (فَقَالَ لَهُمْ رَسُولُ اللّٰهِ نَاقَةَ اللّٰهِ وَسُقْيٰيهَاۜ) **Allah-Təalanın peyğəmbəri** (Saleh) **onlara dedi: "Ey camaat, Allah-Təalanın dəvəsinə və su içməsinə etiraz etməyib, ona əziyyət etməkdən çəkinin.** (Onların diyarında su az olduğundan bir gündən bir suyu dəvə içirdi, lakin əvəzində onlara süd verirdi. Onlar buna dözməyib, onu öldürməyə niyyət etdilər. Bu mətləbin təfsilatı kitabın birinci cildində keçibdir).

**14)** (فَكَذَّبُوهُ فَعَقَرُوهَاۙ) **Salehi təkzib edib, dəvənin arxa ayağının damarını kəsib, öldürdülər.** (Ətini bölüşdürüb, yedilər).

(فَدَمْدَمَ عَلَيْهِمْ رَبُّهُمْ بِذَنْبِهِمْ فَسَوّٰيهَاۙ) **- Onların rəbbi Allah-Təala günahları** (Salehi təkzib edib, dəvəni öldürmək) **səbəbinə onları əzabı ilə əhatə edib, kiçik-böyük hamısına şamil etdi, hamısı həlak olub, nicat tapan olmadı.**

وَلَا يَخَافُ عُقْبَٰهَا ﴿١٥﴾

---

**15) (وَلَا يَخَافُ عُقْبَٰهَا ) Və bu əzabın aqibətindən** (görəsən digər əzab edənlər kimi bu əzabın əvəzində mənə nə olacaqdır?) **Allah-Təala qorxmayıb, hamısını məhv etdi.** (Ey Məhəmməd), **Qüreyş camaatı heç bir cəhətdən onlardan artıq deyildir. Onlara əzab göndərib, həlak etməyə qadirəm.**

Allaha həmd olsun, əş-Şəms surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim əş-Şəms surəsini oxusa, günəş və ayın üzərinə doğduğu şeylərin hamısını Allah-Təala yolunda sədəqə vermiş kimi olar"*.

## əl-LEYL SURƏSİ

92-ci surədir. Məkkədə nazil olub, 21 ayə, 71 kəlmə və 310 hərfdir.

وَالَّيْلِ اِذَا يَغْشٰى ﴿١﴾ وَالنَّهَارِ اِذَا تَجَلّٰى ﴿٢﴾ وَمَا خَلَقَ الذَّكَرَ وَالْاُنْثٰى ﴿٣﴾ اِنَّ سَعْيَكُمْ لَشَتّٰى
﴿٤﴾ فَاَمَّا مَنْ اَعْطٰى وَاتَّقٰى ﴿٥﴾ وَصَدَّقَ بِالْحُسْنٰى ﴿٦﴾ فَسَنُيَسِّرُهُ لِلْيُسْرٰى ﴿٧﴾ وَاَمَّا مَنْ بَخِلَ
وَاسْتَغْنٰى ﴿٨﴾ وَكَذَّبَ بِالْحُسْنٰى ﴿٩﴾ فَسَنُيَسِّرُهُ لِلْعُسْرٰى ﴿١٠﴾ وَمَا يُغْنٖي عَنْهُ مَالُهُ اِذَا تَرَدّٰى ﴿١١﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (وَالَّيْلِ اِذَا يَغْشٰى) And olsun o gecəyə ki, onun qaranlığı günəşin nurunu örtür,**

**2) (وَالنَّهَارِ اِذَا تَجَلّٰى) və and olsun o gündüzə ki, təcəlli edib günəşin nurunu izhar edir.** (Bu ayə əş-Şəms surəsindəki oxşar ayənin təfsirində qeyd olunan mətləbə şəhadət edir. Yəni yerin hərəkət etməsi ilə gündüz meydana gəlib, günəşin nuru yer əhlindən ötrü zahir olur).

**3) (وَمَا خَلَقَ الذَّكَرَ وَالْاُنْثٰى) Və and olsun böyük qüdrət sahibi olan Allah-Təalaya ki, öz kamil qüdrəti ilə kişi və qadını yaradıb, yer üzünə yaydı.**

**4) (اِنَّ سَعْيَكُمْ لَشَتّٰى) Həqiqətən, sizin səy edib, əməl etməyiniz müxtəlifdir. Necə ki, sizə əmr olunub, əməl etməyib, itaət etmirsiniz.** (Növbəti ayələrdə də əməllərin müxtəlif olmasını bəyan edir).

**5-6) (فَاَمَّا مَنْ اَعْطٰى وَاتَّقٰى وَصَدَّقَ بِالْحُسْنٰى) Amma kim ki, malının haqqını** (zəkat, sədəqə) **verib, Allah-Təaladan qorxub, günah əməlləri tərk edib, islamı təsdiq etsə,**

**7) (فَسَنُيَسِّرُهُ لِلْيُسْرٰى) elə şəxsə yardım edərik, belə ki, Allah-Təalaya itaət və ibadət etmək onun üçün digər işlərdən asan olub, tamamilə Allah-Təalanın itaətinə meyl və rəğbət edər.**

**8-9) (وَاَمَّا مَنْ بَخِلَ وَاسْتَغْنٰى وَكَذَّبَ بِالْحُسْنٰى) Amma kim ki, xəsislik edib, malının haqqını verməyib, özünü Allah-Təalaya möhtac saymayıb, dini təkzib etsə.**

**10) (فَسَنُيَسِّرُهُ لِلْعُسْرٰى) biz də elə şəxsdən yardımımızı kəsərik, ta ki, şər və fəsada yönəlib, xəbis əməllərə qurşanmaq onun üçün asan olar.**

**11) (وَمَا يُغْنٖي عَنْهُ مَالُهُ اِذَا تَرَدّٰى) Xəsis şəxs malının haqqını verməyib, din və millətə yardım etməsə, ölüm ona gəlib, cəhənnəmin dibinə düşəndə,**

اِنَّ عَلَيْنَا لَلْهُدٰىۘ ﴿١٢﴾ وَاِنَّ لَنَا لَلْاٰخِرَةَ وَالْاُو۫لٰى ﴿١٣﴾ فَاَنْذَرْتُكُمْ نَارًا تَلَظّٰىۚ ﴿١٤﴾ لَا يَصْلٰيهَٓا اِلَّا
الْاَشْقٰىۙ ﴿١٥﴾ اَلَّذ۪ي كَذَّبَ وَتَوَلّٰىۜ ﴿١٦﴾ وَسَيُجَنَّبُهَا الْاَتْقٰىۙ ﴿١٧﴾ اَلَّذ۪ي يُؤْت۪ي مَالَهُ يَتَزَكّٰىۚ ﴿١٨﴾

---

**o vaxt o mal ona nə fayda verəcək?** (Ondan sonra var-dövlət insana fayda verməz, xəbis varislərə miras qoyub getməkdənsə millətin xeyri üçün sərf edib, onların ehtiyac və nöqsanlarını düzəltmək yaxşıdır, nəinki anbarlarda toplayıb, özü də öləndən sonra bunun günahını özü ilə aparıb, varisləri bol nemət içində saxlamaq).

**12)** (اِنَّ عَلَيْنَا لَلْهُدٰىۘ) - (Ey Məhəmməd), **həqiqətən, dəlil və sübutları ortaya qoyub, şəriət və ehkam verməklə insanları haqq tərəfinə irşad və hidayət etmək bizə lazımdır. Elə ki, biz onları irşad etdik, ondan sonra haqqa tabe olub olmamaq, öz ixtiyarlarıyla olub, onlara heç bir zor və məcburiyyət yoxdur. Belə vaxtda haqqa tabe olanlara əcr və savab verib, olmayanlara əziyyət edərik.**

**13)** (وَاِنَّ لَنَا لَلْاٰخِرَةَ وَالْاُو۫لٰى) **Və həqiqətən, dünya və axirət hər ikisi bizə məxsus, bizim hakimiyyətimizdədir. Bizdən başqa hardan nicat istəsələr, yolu itirib zəlalətə düşərlər. Zəlalətə vaqe olandan bizə zərər, mənfəət əldə edəndən bizə bir xeyir gəlməyib, xeyir və zərər özlərinə aiddir.**

**14)** (فَاَنْذَرْتُكُمْ نَارًا تَلَظّٰىۚ) **- Mən siz** (insanları) **alovlanan bir atəşin əzabı ilə qorxutdum ki, haqqa tabe olub küfr və şirkdən üz döndərəsiniz.** (Həqiqətən, insanları hidayət və irşad etməkdən ötrü gah müjdələmək, gah qorxutmaq lazımdır. Qurani-Şərifdə göstərilən yoldan daha gözəl bir yol ağıla gəlmir və bu səbəbdən müjdə və qorxutduqdan sonra daha üzrxahlıq edə bilməyib, itaət edənlərə savab, müxalif olanlara əzab veriləcəkdir).

**15-16)** (لَا يَصْلٰيهَٓا اِلَّا الْاَشْقٰىۙ اَلَّذ۪ي كَذَّبَ وَتَوَلّٰىۜ) **- O alovlanan atəşə Allah-Təalaya iman gətirməkdən üz döndərib, peyğəmbərləri təkzib edən asi şəxslərdən başqası daxil olmaz.**

**17-18)** (وَسَيُجَنَّبُهَا الْاَتْقٰىۙ اَلَّذ۪ي يُؤْت۪ي مَالَهُ يَتَزَكّٰىۚ ) **- Özünü Allah-Təalanın yanında pak və qüsursuz etməkdən ötrü malını Allah-Təala yolunda* millətin ehtiyacı üçün sərf edən müttəqi şəxs elə alovlu atəşdən uzaqlaşdırılıb, ora daxil edilməyəcəkdir.**

**(*Qeyd:** *"Mədinədə peyğəmbərin (ə.s) müəzzini Bilal ibn Rəyah (Rəbah) idi, anasının adı Hümamədir. Məkkədə Ümeyyə ibn Xələfin qulamı idi. Peyğəmbərə iman etdi. Ümeyyə onu Məkkənin kənarına aparıb, günün altında, daşların üstündə onu arxası üstə uzadıb, sinəsinə böyük daşlar yığıb deyirdi: ölənə kimi gərək belə qalasan, ya da ki, Məhəmmədə kafir olasan. Bilal həmin daşların altından "Əhəd-Əhəd" (Allah birdir) deyirdi. Əbu Bəkir onu o halda gördü.*

وَمَا لِأَحَدٍ عِنْدَهُ مِنْ نِعْمَةٍ تُجْزٰىۙ ﴿١٩﴾ اِلَّا ابْتِغَٓاءَ وَجْهِ رَبِّهِ الْاَعْلٰىۚ ﴿٢٠﴾

---

*Əbu Bəkrin evi Ümeyyə İbn Xələfin qəbiləsi olan Bəni Cümə (Cümah) camaatına yaxın idi. Bilalın ağası olan Ümeyyəyə dedi: "Bu yoxsula belə zülm edib, Allah-Təaladan qorxmursan? Ümeyyə dedi: "Sən bunu dinindən çıxarıb, bu günə qoymusan. İndi onu xilas et. Əbu Bəkir dedi: xilas edirəm, bunu burax, mənim daha cəld bir qulamım var, sənin dinindəndir, onu sənə verirəm, bunu mənə ver. Ümeyyə qəbul etdi. Əbu Bəkir kafir qulamını verib, Bilalı alıb azad etdi. O vaxta kimi altı qulam və kəniz alıb azad etmişdi. Bilal yeddinci oldu. Amir ibn Füheyrə islama daxil oldu. Əbu Bəkir azad etdi. Amir Bədir və Uhud savaşlarında iştirak etdi. Bi`r Maunə savaşında şəhid oldu. 2- Ümmü Ümeys, 3-Zöhrə adlı kənizləri alıb azad etdi. 4-5- Nəhdiyyə ilə Bürdə (Lübeynə) adlı qızını da alıb azad etdi. 6-Bəni-Müəmməl tayfasından bir kənizə müsəlman olduğu üçün əzab edildiyini gördü, xeyli məbləğ ödəyib, onu da alıb azad etdi. Səhabələrdən Əmmar ibn Yasir Əbu Bəkri mədh edən bir qəsidə deyib, onun azad etdiyi Bilalı və digər qulam və kənizləri qəsidədə qeyd edir. Əbu Bəkir onun ləqəbidir. Qəsidədən bir neçə beyti bu kitabda qeyd etməyi faydalı gördüm.*

*- "Allah Bilal və yoldaşlarını azad etdiyi üçün Atiqi xeyirlə mükafatlandırsın. O varlı (Ümeyyəni) və Əbu Cəhli rəzil və rüsvay etsin. İkisi də Bilala pislik etdi. Ağıllı şəxsin aləmlərin rəbbindən qorxması kimi qorxmadılar. Bilal: - məcbur olmadan şəhadət edirəm ki, rəbbim Allahdır, məni öldürmək istəyirsinizsə, öldürün. Əbədi rəhman olan rəbbimə şirk qoşmaram. Ey İbrahimin, gözəl qul Yunisin, Musa və İsanın rəbbi, mədəd et! Qurtar məni! Heç bir haqq və ədalətə riayət etmədən davamlı zülm edən bu azğınlara möhlət vermə! - deyərək fəryad edirdi".*

*Bu qəsidədə Əmmar ibn Yasir Əbu Bəkri mədh edib, Bilal və onunla birlikdə iman edənlərin islam yolunda müşriklərin əzab və əziyyətlərinə səbir edib, səbatla xidmət etmələrini vəsf edir. Məkanları cənnət olsun. İslamı dirildib, yayan bunlardır. Gərək həmişə bunların adlarını yad edib, əhvalatlarından ibrət alaq, lakin ibrət alan varmı?)*

**19) (وَمَا لِأَحَدٍ عِنْدَهُ مِنْ نِعْمَةٍ تُجْزٰىۙ) Heç bir nəfərdən ötrü Allah-Təala yanında elə bir nemət yoxdur ki, Allah-Təala o nemətə qarşılıq verməsin.**

**20) (اِلَّا ابْتِغَٓاءَ وَجْهِ رَبِّهِ الْاَعْلٰىۚ) Ancaq o şəxs ki, şanı və cəlalı uca mərtəbədə olan Allah-Təalanın məmnunluğundan ötrü malını millətin yolunda sərf etsə, belə şəxsin əməli Allah-Təalanın yanında bir nemətdir. Əlbəttə, ona mükafat verəcəkdir.**

وَلَسَوْفَ يَرْضٰى ﴿٢١﴾

---

**21) (وَلَسَوْفَ يَرْضٰى) Və əlbəttə o mükafatdan onun gözləri işıqlanıb, razı olacaqdır.**

Allaha həmd olsun, əl-Leyl surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim əl-Leyl surəsini oxusa, Allah-Təala ona razı olana qədər savab bəxş edər."*

## əz-ZUHA SURƏSİ

93-cü surədir. Məkkədə nazil olub, 11 ayə, 40 kəlmə və 172 hərfdir.

وَالضُّحٰىۙ ﴿١﴾ وَالَّيْلِ اِذَا سَجٰىۙ ﴿٢﴾ مَا وَدَّعَكَ رَبُّكَ وَمَا قَلٰىؕ ﴿٣﴾ وَلَلْاٰخِرَةُ خَيْرٌ لَكَ مِنَ الْاُولٰىؕ ﴿٤﴾ وَلَسَوْفَ يُعْطِيكَ رَبُّكَ فَتَرْضٰىؕ ﴿٥﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

(Bir neçə gün peyğəmbərə vəhy gəlmədi, soruşanlara da deyirdi: "Mənə bir şey nazil olmayıbdır. Müşriklər fürsət tapıb dedilər: "Məhəmmədin rəbbi Allah-Təala ona düşmən olub, tərk edib, daha ona bir şey göndərmir. Əbu Ləhəbin arvadı Ümmü Cəmil peyğəmbəri görəndə belə deyirdi: "Ey Məhəmməd, görürəm ki, Allahın səni tərk edib, daha sənə bir şey öyrətmir. Bu barədə həmin surə nazil oldu).

**1-2) (وَالضُّحٰىۙ وَالَّيْلِ اِذَا سَجٰىۙ) And olsun günəşin şüasının yayıldığı zamana və and olsun gecəyə ki, təbiət sakin olarkən, hər bir şeyi qaranlığa bürüyər.**

**3) (مَا وَدَّعَكَ رَبُّكَ وَمَا قَلٰىؕ)** - (Ey Məhəmməd), **sənin rəbbin Allah-Təala səni seçəndən sonra səni tərk etməyib və nə də səni sevəndən sonra sənə düşmən olmayıbdır. Necə ki, səni xalqın arasından seçib, özünə dost edib, peyğəmbər göndərib, o səviyyədə də qalacaqsan. Qüreyş tayfasının boş və mənasız sözlərinə etina etməyib, onlardan üz döndər. Allah-Təala mərhəmətini sənə şamil edib, səni dünyada uca edəcəkdir.**

**4) (وَلَلْاٰخِرَةُ خَيْرٌ لَكَ مِنَ الْاُولٰىؕ)** - (Ey Məhəmməd), **sənin işinin sonu səndən ötrü indikindən də yaxşı olub, düşmənə qalib olub, dinin yer kürəsinə yayılacaqdır.**

**5) (وَلَسَوْفَ يُعْطِيكَ رَبُّكَ فَتَرْضٰىؕ)** - (Ey Məhəmməd), **əlbəttə sənin Allahın sənə düşmənlərinə qarşı zəfər çalıb, fəth etməyi* elə müyəssər edəcəkdir ki, sən özün razı olacaqsan.**

**(*Qeyd:** *"Bədir savaşı, Məkkənin fəthi, digər savaşlarda peyğəmbər müşriklərə qalib olub, onlar da dəstə-dəstə islama daxil oldular. Peyğəmbərin sağlığında islamın Ərəbistan yarımadasında, özündən sonra raşid xəlifələr zamanında isə dünyaya yayılması ayədəki fəth müjdəsini təsdiq edir. Ayə peyğəmbərin doğruluğuna və iddiasının haqq olmasına böyük sübut və dəlildir. Müjdənin daha əvvəldən verilməsi peyğəmbərin doğruluğuna böyük dəlildir. Daha əvvəl işarə etdiyimiz kimi bu surə Məkkədə nazil olub, islamın yayılması və fəthlər isə hicrətdən*

اَلَمْ يَجِدْكَ يَتِيمًا فَاٰوٰىۖ ﴿٦﴾ وَوَجَدَكَ ضَٓالًّا فَهَدٰىۖ ﴿٧﴾ وَوَجَدَكَ عَٓائِلًا فَاَغْنٰىۜ ﴿٨﴾

*sonra meydana gəlibdir və bu səbəbdən surə peyğəmbərin doğruluğunu göstərən bir möcüzə olduğundan, müşriklər ondan ayrı möcüzələr istəyəndə, onları rədd edib, belə deyirdi: "Məndən möcüzə zühura gəlməyib, mən oyunbaz deyiləm, peyğəmbərəm, möcüzəm Qurandır, əgər siz də bacarırsanız, onun bənzəri kiçik bir surə gətirin. Peyğəmbər (ə.s) doğru deyib. Növbəti ayədə Allah-Təala uşaqlıqdan ta yetkinliyinə kimi peyğəmbərə bəxş etdiyi nemətləri sayır və bundan başqa şeyləri də sənə verməyə qadirəm, deməyə işarə edir).*

**6) (اَلَمْ يَجِدْكَ يَتِيمًا فَاٰوٰىۖ)** - (Ey Məhəmməd), **sənin rəbbin Allah-Təala səni ata və anadan* yetim tapmadımı? Yetim tapandan sonra səni** (Əmin Əbu Talibə) **tapşırdı, sənə tərbiyə verib, yetkinliyə çatdın.** (Bəs bu, səndən ötrü böyük bir nemət və mərhəmət deyildirmi?)

**(*Qeyd:** *"Peyğəmbər (ə.s) pak anasının bətnində hələ altı aylıq ikən, atası Abdullah Şamdan ticarət karvanı ilə qayıdıb Məkkəyə gedəndə Mədinədə vəfat etdi. Peyğəmbər anadan olandan sonra babası Əbdülmüttəlib Bəni Səid qəbiləsindən Həlimə adlı qadını ondan ötrü dayə tutdu, o da Hz. Məhəmmədi aparıb, qəbiləsində saxlayıb, süd verirdi. Məkkədə Qüreyş qadınları uşağa süd verməyi özlərinə eyib sayıb, çöl havası şəhərin havasından saf olduğuna görə bədəvi ərəbilərdən dayə tutub, uşağı onlara verib, aparıb çöldə saxlayırdılar. Lakin Həlimə bir neçə aydan bir Hz. Məhəmmədi gətirib, babası Əbdülmüttəlib və anası Əminə ilə görüşdürəndən sonra yenə aparıb, qəbilədə ona ən gözəl şəkildə baxırdı. Əbdülmüttəlib Hz. Məhəmmədə görə Həlimənin ücrətini artıq edib, ona yardım edirdi. Elə ki, iki ildən sonra süddən aralandı, Həlimə Hz. Məhəmmədi gətirib, Əbdülmüttəlibə və anası Əminəyə tapşırdı. Ondan sonra xahiş edib dedi: "Bu hava ona zərər verəcəkdir, bunu mənə həvalə edin, aparım bunu çöldə saxlayım. Əbdülmüttəlib və Əminə razı oldular. Hz. Məhəmmədi aparıb çöldə saxladı. Altı yaşına çatanda anası, səkkiz yaşında isə babası Əbdülmüttəlib vəfat etdi. Əmisi Əbu Talib uşağı öz himayəsinə götürdü. Necə ki, ayədə xəbər verir).*

**7) (وَوَجَدَكَ ضَٓالًّا فَهَدٰىۖ)** - (Ey Məhəmməd), **bizim nemətlərimizdən biri də budur ki, Allah-Təala səni şəriətdən və eşitməklə* öyrənilən elmlərdən uzaq tapıb, sənə kitab göndərib öyrətdi.**

**(*Qeyd:** *"Ağıl tövhid elmini anlamağa qabil olduğuna görə Hz. Məhəmməd peyğəmbərlikdən əvvəl tövhidi ağlı ilə dərk edib, müvəhhid olmuş, daha sonra peyğəmbərlik nuru o cənabın alnında parlamışdı).*

**8) (وَوَجَدَكَ عَٓائِلًا فَاَغْنٰىۜ) Yenə** (Ey Məhəmməd), **Allah-Təala səni yoxsul tapıb, peyğəmbərlik libasını sənə geyindirməklə səni varlı etdi. Bəs bunlar səndən ötrü böyük nemətlər deyilmi? Bunları sənə bəxş edən Allah-Təala səni müşriklərə qalib edib, islamı yaymağa da qadirdir.**

فَأَمَّا الْيَتِيمَ فَلَا تَقْهَرْ ﴿٩﴾ وَأَمَّا السَّائِلَ فَلَا تَنْهَرْ ﴿١٠﴾ وَأَمَّا بِنِعْمَةِ رَبِّكَ فَحَدِّثْ ﴿١١﴾

---

**9) (فَأَمَّا الْيَتِيمَ فَلَا تَقْهَرْ) -** (Ey Məhəmməd), **necə ki sən yetim olarkən*, Allah-Təala sənə tərbiyə verdi, sən də yetimə zülm etmə, əgər malı olsa malını xərcləməyib, gərək qoruyasan, ona mərhəmət edib, tərbiyə verəsən, necə ki, Allah-Təala sənə tərbiyə verib.**

**(*Qeyd:** *"Bu üç ayədə qeyd olunan mətləblər nə gözəl, nə böyük, ali mətləblərdir. Millətin yetim və yoxsul övladlarına mərhəmət edib, onları qorumaq, tərbiyə vermək, yetimin malını mühafizə etmək lazımdır, bizim bu zamanda isə qəyyumlar it sümüyü udan kimi yetimin malını yeyirlər. Bu ayələrin məzmunlarına diqqət edilməlidir. Xüsusən axırıncı ayədə deyildiyi kimi elmin yayılması üçün səy edib, elmi olan şəxslər elmlərini gizlətməyib, yaymalıdırlar. Ayələrin xitabı Quranın əksər xitabları kimi peyğəmbərə olsa da, hökmü bütün müsəlmanlara şamildir. Bütün Quran əhli bu ayələrə əməl etməyə məcburdurlar. Belə ayələr ola-ola, bu nə cəhalətdir ki, biz müsəlmanlar düşmüşük? Qurani-Şəriflə əməl etmək tərk edilib, uydurma rəvayətlər bizim aramızda rəvac tapıb, alim olmayanlar özünü alim kimi göstərir. İnsanlar bu qədər cəhalət xəstəliyinə düçar olsalar da, inanıram ki, çalışmaqla islamın düşmənlərini dəf edib, islam ümmətini onların çəngindən xilas edib, elm və hidayətə yönəltmək olar. Adını hər fəqih qoyanın gündə bir yeni ehkam gətirməsinin nəticəsidir ki, islam dini belə pozulub. Çalışmaq, qeyrət göstərmək lazımdır).*

**10) (وَأَمَّا السَّائِلَ فَلَا تَنْهَرْ) - Əgər dilənçi gəlib səndən bir şey istəsə, ona qəzəblənib, sir-sifətini turşutma. Ya bir şey ver, ya da ki, gözəl şəkildə onu yola sal.**

**11) (وَأَمَّا بِنِعْمَةِ رَبِّكَ فَحَدِّثْ) Amma rəbbin Allah-Təalanın sənə verdiyi** (elm) **nemətini gizlətməyib, insanlardan əsirgəməyib, onları öyrədib, cəhalətdən xilas et.**

Allaha həmd olsun, əz-Zuha surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim əz-Zuha surəsini oxusa, Allah-Təala ona on savab bəxş edər."*

## İNŞİRAH (ƏLƏM NƏŞRAH) SURƏSİ

94-cü surədir. Məkkədə nazil olub, 8 ayə, 27 kəlmə və 103 hərfdir.

اَلَمْ نَشْرَحْ لَكَ صَدْرَكَ ﴿١﴾ وَوَضَعْنَا عَنْكَ وِزْرَكَ ﴿٢﴾ اَلَّذِيٓ اَنْقَضَ ظَهْرَكَ ﴿٣﴾ وَرَفَعْنَا لَكَ
ذِكْرَكَ ﴿٤﴾ فَاِنَّ مَعَ الْعُسْرِ يُسْرًا ﴿٥﴾ اِنَّ مَعَ الْعُسْرِ يُسْرًا ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (اَلَمْ نَشْرَحْ لَكَ صَدْرَكَ)** - (Ey Məhəmməd), **sənin qəlbini açıb*, genişlik vermədikmi? Ta ki, peyğəmbərliyin ağır yükünə, müşriklərin əzab və əziyyətlərinə dözüb, onları dəvət edəsən və bundan əlavə qəlbin hər bir elm və hökmə agah olub, genişlədi.**

**(*Qeyd:** *"Qəlbin genişlənməsi barəsində təfsirçilərin əksəriyyəti qəribə, əcaib, adamı güldürən sözlər yazıblar. Onların hamısından üz döndərib, ayənin ehtiva etdiyi əsl həqiqi mənanı qeyd etdim. O sözlərə agah olmaq istəyənlər digər təfsir kitablarına baxsınlar).*

**2) (وَوَضَعْنَا عَنْكَ وِزْرَكَ)** - (Ey Məhəmməd), **belinə ağırlıq salıb, sümüklərini sındıran peyğəmbərliyin və təbliğin çətinliklərini sənin üçün asan etdik. Ta ki, elə əzəmətli işlərə yönələ bildin.**

**3) (اَلَّذِيٓ اَنْقَضَ ظَهْرَكَ وَرَفَعْنَا لَكَ ذِكْرَكَ)** - (Ey Məhəmməd), **sənin adını təzim və hörmətlə deməyi ucaltdıq, yer kürəsinin hər bir nöqtəsində sənin adın deyilib, məşhur olub, sənə həmd-səna edəcəklər. Həqiqətən, peyğəmbərin doğruluğuna və haqlılığına bu da böyük bir dəlildir. Yer kürəsində elə bir yer var ki, orada uca peyğəmbərimizin uca adı məşhur olmayıb, onun elm və kamilliyi məclislərin bəzəyi olmasın? Onun doğruluğuna və haqlılığına bundan böyük dəlil varmı?**

**5) (فَاِنَّ مَعَ الْعُسْرِ يُسْرًا)** - (Ey Məhəmməd), **müşriklərin istehza və əziyyətlərinə, təbliğ işində hər bir zəhmətə səbir edib, səhabələrini də səbir etməyə vadar et. Həqiqətən, bu zəhmət və məşəqqətə ki, dözürsünüz, əlbəttə bunun dalınca sizdən ötrü zəfər və şadlıq olacaqdır. Qəm-qüssədən azad, düşmənə qalib olub, onların şərindən asudə olmaq sizin üçün təqdir olunubdur. Öz işinizdə möhkəm olub, zəfəri gözləyin.**

**6) (اِنَّ مَعَ الْعُسْرِ يُسْرًا)** - (Ey Məhəmməd), **yenə təkrar edirəm ki, sənə iman edənlər xatircəm olsunlar ki, bu şiddət və məşəqqətdən tezliklə xilas olub,**

فَاِذَا فَرَغْتَ فَانْصَبْۙ ﴿٧﴾ وَاِلٰى رَبِّكَ فَارْغَبْ ﴿٨﴾

---

**düşmənə qalib olub, onların şərindən asudə olmaq təqdir olunubdur. Əlbəttə, işiniz irəliləyəcəkdir, kədərlənməyin.** (Bu ayə də peyğəmbərin doğruluğuna və haqlılığına böyük dəlil və sübutdur).

**7) (فَاِذَا فَرَغْتَ فَانْصَبْۙ)** - (Ey Məhəmməd), **heç vaxt boş dayanmayıb, vaxtını zay etmə, vaxt qənimətdir. Vaxt varkən fürsəti buraxmayıb, peyğəmbərliyi təbliğ işinə davam et, diqqətsizlik və tənbəllik etmə. Elə ki, bir işi qurtardın, başqa bir işlə məşğul olub, insanları dəvət et, gah müjdələ, gah qorxut, gah sərt, gah mülayim, vəziyyətə uyğun olaraq işinə davam et.**

**8) (وَاِلٰى رَبِّكَ فَارْغَبْ) Hər bir işində ancaq Allah-Təalaya meyl və təvəkkül edib, bütün işlərini Ona həvalə et və Ondan yardım istə. Çünki mütləq qüdrət və ixtiyar sahibi Allah-Təaladır.**

Allaha həmd olsun, İnşirah (Ələm nəşrah) surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim İnşirah surəsini oxusa, sanki mən qəmgin olduğum halda mənim yanıma gəlib məni şad edibdir."*

## ət-TİN SURƏSİ

95-ci surədir. Məkkədə nazil olub, 8 ayə, 34 kəlmə və 105 hərfdir.

وَالتّٖينِ وَالزَّيْتُونِۙ ﴿١﴾ وَطُورِ سٖينٖينَۙ ﴿٢﴾ وَهٰذَا الْبَلَدِ الْاَمٖينِۙ ﴿٣﴾ لَقَدْ خَلَقْنَا الْاِنْسَانَ فٖيٓ اَحْسَنِ
تَقْوٖيمٍۘ ﴿٤﴾ ثُمَّ رَدَدْنَاهُ اَسْفَلَ سَافِلٖينَۙ ﴿٥﴾ اِلَّا الَّذٖينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ فَلَهُمْ اَجْرٌ غَيْرُ
مَمْنُونٍۜ ﴿٦﴾

---

### Bismillahir-Rəhmanir-Rəhim

**1-2)** (وَالتّٖينِ وَالزَّيْتُونِۙ وَطُورِ سٖينٖينَۙ) - (Ey Məhəmməd), **əncir və zeytuna və Sinin* adlı məkanda olan Tur dağına and olsun.**

(***Qeyd:** *“Musaya isnad edilən Tur dağının məkanı Sina adlandığı kimi Sinin də adlanır. “Zammə” (“u” səsi) halında Sinun deyilir).*

**3)** (وَهٰذَا الْبَلَدِ الْاَمٖينِۙ) **Və and olsun əmin olan bu Məkkə şəhərinə ki, gərək insanlar burada hər bir cəhətdən əmin-amanda olub, bir-birilərinə əziyyət etməsinlər.**

**4)** (لَقَدْ خَلَقْنَا الْاِنْسَانَ فٖيٓ اَحْسَنِ تَقْوٖيمٍۘ) **Həqiqətən, öz kamil qüdrətimizlə insanı gözəl qədd-qamətlə və xoş surətdə yaradıb, elm, kamal, fəhm, şüur, ağıl, fərasət, nitq və idrak ilə digər canlılardan fərqləndirdik. Heç bir heyvanı insan surətində, ya insandan yaxşı surətdə yaratmadıq. Gərək insan belə nemətlərə şükür edib, gözəl xüsusiyyətlər, elm və kamal əldə etməklə batinini təmizləyib, bunlarla bəzənib, həqiqi insan olsun.**

**5)** (ثُمَّ رَدَدْنَاهُ اَسْفَلَ سَافِلٖينَۙ) **Sonra insan nəfsani istəklərinə tabe olub, şəhvətə aldanınca cəhalət vadisində çarəsiz heyvanlar kimi sərgərdan qaldı. Özü kimi insanlara əziyyət etməklə bizim mənəvi yaxınlığımızdan uzaqlaşdırıldı. Heyvanlardan da alçaq və əskik səviyyəyə salıb, insanlıq aləmindən çıxartdıq və bu səbəbdən axirətdə cəhənnəmin ən aşağı qatında əzaba düçar olacaqdır.**

**6)** (اِلَّا الَّذٖينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ فَلَهُمْ اَجْرٌ غَيْرُ مَمْنُونٍۜ) **Ancaq o şəxslər ki,** (insanlardan) **iman edib, müvəhhid olub, gözəl əməllər edib, elm, kamal, mərifət əldə edib, gözəl sifətlərə sahib olsalar, onlar həqiqətən insan hesab olunub, bizim yaxınlığımıza daxil olarlar. Biz də elə şəxsləri özümüzə yaxın hesab edərik və bu səbəbdən onlardan ötrü sonsuz əcr və savab hazırlanıbdır.**

فَمَا يُكَذِّبُكَ بَعْدُ بِالدِّينِ ﴿٧﴾ اَلَيْسَ اللهُ بِاَحْكَمِ الْحَاكِمِينَ ﴿٨﴾

---

**7) (فَمَا يُكَذِّبُكَ بَعْدُ بِالدِّينِ)** - (Ey Məhəmməd), **sənin haqlılığını göstərmək üçün belə dəlil və sübutları insanlara bəyan edəndən sonra səni təkzib edib, sözünü qəbul etməyən kimdir? Gərək hər bir ağıllı şəxs qəbul etsin. Bununla belə inkar edənlər də vardır, lakin elə şəxslərə etina etmə, şübhəsiz ki, onlar heyvanlardan da alçaqdır, sən elmə və gözəl əxlaqa dəvət edirsən, bunları qəbul etməyənlər əlbəttə, insanlıqdan kənardırlar.**

**8) (اَلَيْسَ اللهُ بِاَحْكَمِ الْحَاكِمِينَ)** - (Ey Məhəmməd), **Allah-Təala bütün hökm edənlərin hamısından daha artıq haqq və ədalətlə hökm edən deyildirmi? Əlbəttə, belədir. Buna görə də səninlə səni təkzib edənlərin arasında haqq və ədalətlə hökm edib, onları zəlil edəcəkdir. O günü gözlə.**

Allaha həmd olsun, ət-Tin surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *“Kim ət-Tin surəsini oxusa, Allah-Təala dünyada ona iki gözəl xasiyyət verər. Birincisi - hər bir cəhətdən sağ-salamat olmaq, ikincisi - elm və iman sahibi olmaq.”* (Yəni belə ilahi kəlamları dərk edib, həqiqətən anlayan şəxs əvvəlcə elm sahibi olar, sonra da insanların arasında fitnə-fəsad çıxartmaqdan uzaq olub, sağ-salamat qalar).

## əl-ƏLƏQ SURƏSİ

96-cı surədir. Məkkədə nazil olub, 19 ayə, 92 kəlmə və 280 hərfdir.

اِقْرَاْ بِاسْمِ رَبِّكَ الَّذ۪ي خَلَقَۚ ﴿١﴾ خَلَقَ الْاِنْسَانَ مِنْ عَلَقٍۚ ﴿٢﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)* (اِقْرَاْ بِاسْمِ رَبِّكَ الَّذ۪ي خَلَقَ)** (Ey Məhəmməd), **insanı yoxdan yaradan rəbbin Allah-Təalanın adıyla başlayıb, ondan sonra oxu.** (Yəni oxuyanda "bismillahir-Rəhmanir-Rəhim" deyib, ondan sonra oxumaq lazımdır).

**2) (خَلَقَ الْاِنْسَانَ مِنْ عَلَقٍۚ ) Allah-Təala öz kamil qüdrəti ilə insanı** (ananın bətnindəki spermadan yaranan) **bir parça laxtalanmış qandan yaratdı.**

**(*Qeyd:** *"Bu surə Qurani-Şərifin peyğəmbərə nazil olan ilk surəsidir və bu səbəbdən ayənin əvvəlində oxumaq əmri verilibdir. Peyğəmbərliyin ilk dəlil və sübutu Hz. Məhəmmədin vəhydən öncəki doğru yuxuları idi. Gördüyü yuxular hamısı düz çıxırdı. Bir müddət sonra insanlardan uzaqlaşıb, guşənişin olmaq ona sevdirildi və bu səbəbdən Hira dağındakı mağarada bir neçə gün və gecə guşənişin olub, ağlı ilə inandığı məbuduna sitayiş eləməyə başladı. Ondan sonra Məkkəyə qayıdıb, bir neçə gün Xədicənin yanında qalıb, yenə geri dönərdi. Bir gecə Hira dağında olarkən, gecə yatıb, əbasını başına çəkmişdi. Əbanın altından mağaranın işıqlanması o cənaba məlum olub, dəhşətə gəldi. Bir qədər sonra mağaranın nuru daha da artdı. O cənab məcbur qalıb, başını əbadan çıxartdı. Allah-Təala tərəfindən Ruhül-əmin (Cəbrayıl) "iqra" (oxu!) - (Ey Məhəmməd), deyib o cənaba oxumağa əmr etdi. O cənab "və ma ənə bi qari" (mən oxumuş deyiləm) cavabını verdi. Cəbrayıl ikinci və üçüncü dəfə oxumaq əmri versə də, peyğəmbər eyni cavabı verdi. Axırda peyğəmbəri elm və maarif nuru ilə bürüyüb, qəlbini açıb, Ələq surəsinin əvvəlindən ta "əlləməl-insanə ma ləm yə`ləm" (insana bilmədiyini öyrətdi) ayəsinə qədər peyğəmbərə oxuyub, qeyb oldu. O cənab çaşıb qalmışdı. Axırda iztirab içində Hira dağından Məkkəyə qayıdıb, Xədicənin yanına daxil olub üzü üstə düşüb dedi: "Mənim üstümü örtün. Üstünü örtdülər, yenə o halda ikən Ruhül-əmin ona gəlib Muddəssir surəsindən "ya eyyuhəl-muddəssir, qum fənzur" (ey örtüsünə bürünən, qalx, qorxut) ayəsini oxuyub, ona peyğəmbərliyi təbliğ etməyi əmr etdi. O cənab qalxıb əhvalatı pak Xədicəyə xəbər verib dedi: "Həqiqətən qorxuram. Xədicə o cənaba təsəlli verib dedi: "Qorxma, Allah-Təala səni zəlil etməz. Sən hər bir işində sadiq, qohuma yaxşılıq edən, qonaq saxlayıb, kasıblara yardım edənsən. Allah-Təala səni qoruyar. Xədicə o cənabı götürüb, əmisi oğlu Varaqa ibn Novfəlin yanına apardı. Varaqa xristianlığı qəbul edib,*

اِقْرَاْ وَرَبُّكَ الْاَكْرَمُۙ ﴿٣﴾ اَلَّذٖي عَلَّمَ بِالْقَلَمِۙ ﴿٤﴾ عَلَّمَ الْاِنْسَانَ مَا لَمْ يَعْلَمْۜ ﴿٥﴾ كَلَّا اِنَّ الْاِنْسَانَ لَيَطْغٰىۙ ﴿٦﴾ اَنْ رَاٰهُ اسْتَغْنٰىۜ ﴿٧﴾

---

*yəhudi dilində İncili oxumuşdu. Qocalıb, gözləri kor olmuşdu. Xədicə dedi: "Əmi oğlu, gör qardaşın oğlu Məhəmməd, nə deyir? Varaqa dedi: "Qardaşoğlu, nə görübsən? Peyğəmbər vəhy aldığını ona xəbər verdi. Varaqa dedi: "Bu, həmin baş mələkdir ki, Allah-Təala İsaya xəbər veribdir. Kaş ki, sənin qövmün səni buradan qovanda, sağ olub, sənə kömək edəydim. Lakin qısa bir müddət sonra Varaqa vəfat etdi. Ondan sonra peyğəmbər gedib, indi Məkkənin daxilində olan Səfa dağına çıxıb, insanları dəvət etdi, peyğəmbərliyini onlara bildirib, müvəhhid olub şirk və küfrü tərk etməyi əmr etdi. Camaat o cənaba istehza edib, getdilər, ona müxtəlif adlar verdilər).*

**3) (اِقْرَاْ)** - (Ey Məhəmməd), **sənə vəhy olunan ayələri oxuyub yadında saxla. (وَرَبُّكَ الْاَكْرَمُ)**

**4) (اَلَّذٖي عَلَّمَ بِالْقَلَمِۙ) (Ey Məhəmməd)*, lütf və səxavətdə ən böyük kamala sahib olan sənin rəbbin Allah-Təalanın insana olan böyük lütfü və səxavəti odur ki, onları digər məxluqlardan ayırıb, qələmlə yazmağı onlara öyrətdi.**

**(*Qeyd:** *İnsaflı adamlar bu ayələrə baxıb fikir versinlər ki, hansı dinin əsası islamdakı kimi elm, kamal və mərifət üzrə qoyulubdur? Hansı dinin kitabının əvvəli elm və yazmaq əmri ilə başlayıbdır? Peyğəmbərə nazil olan surənin əvvəlinin elm və yazmaq əmri ilə başlaması elmin nə qədər vacib olduğunu bizə bildirib, elm öyrənməyə həvəsləndirir. Biz islam ümməti belə böyük bir əmri, Allah-Təalanın fərmanını necə tərk edib, özümüzü zəlalət və cəhalət girdabına salıb, yarasa kimi günəş işığından qaçırıq. Belə ayələri tərk edib, Qurani-Şərifdən üz döndərib, özümüzü heyvandan əskik etmək rəvadırmı? Burada sözü uzatmağa ehtiyac yoxdur. Biz müsəlmanların bütün dərdlərinin dərmanı və nöqsanlarımızın düzəldilməsi bu ayələrə əməl etməklə mümkündür. Müsəlmanların bu ayələrə sarılması lazımdır. O, nə gözəl vəkildir!)*

**5) (عَلَّمَ الْاِنْسَانَ مَا لَمْ يَعْلَمْ) Yenə Allah-Təalanın lütf və səxavətindəndir ki, onu cəhalət zülmətindən elm nuruna tərəf çıxarıb, bilmədiyi şeyləri insana öyrətdi. Lakin insan zülməti nura, cəhaləti elmə üstün sayıb, özünü vəhşi heyvanların sırasına qatır.**

**6-7) (كَلَّا اِنَّ الْاِنْسَانَ لَيَطْغٰىۙ اَنْ رَاٰهُ اسْتَغْنٰىۜ) - Əlbəttə, insan gərək cəhaləti tərk edib, elmdən üz döndərməsin. Amma həqiqətən, insan nə zaman özünü dünya malı cəhətdən zəngin görsə, tüğyan edib, kamilliyi tərk edib, cəhaləti ilə məğrur olub, aldanandır.**

اِنَّ اِلٰى رَبِّكَ الرُّجْعٰىۜ ﴿٨﴾ اَرَاَيْتَ الَّذ۪ي يَنْهٰىۙ ﴿٩﴾ عَبْدًا اِذَا صَلّٰىۜ ﴿١٠﴾ اَرَاَيْتَ اِنْ كَانَ عَلَى
الْهُدٰىۙ ﴿١١﴾ اَوْ اَمَرَ بِالتَّقْوٰىۜ ﴿١٢﴾ اَرَاَيْتَ اِنْ كَذَّبَ وَتَوَلّٰىۜ ﴿١٣﴾ اَلَمْ يَعْلَمْ بِاَنَّ اللّٰهَ يَرٰىۜ ﴿١٤﴾
كَلَّا لَئِنْ لَمْ يَنْتَهِ۬ لَنَسْفَعًا بِالنَّاصِيَةِۙ ﴿١٥﴾

---

**8) (اِنَّ اِلٰى رَبِّكَ الرُّجْعٰىۜ) Ey insan, tüğyan etmən sənə bir fayda verməz. Həqiqətən, sənin qayıdacağın yer rəbbin Allah-Təalanın tərəfinə olacaqdır. Orada sənə azğınlıq və zəlalət yox, elm və kamal fayda verər.** (Növbəti ayələr Əbu Cəhl haqqında nazil olubdur. O, Qüreyş camaatına deyirdi ki, Məhəmməd gəlib sizin gözünüzün qabağında namaz qılıb, üzünü torpağa qoyur, siz sə heç bir söz demrsiniz. Dedilər: “Bəli, bu haqda ona bir söz demirik. Əbu Cəhl dedi: “Əgər mən onu namaz qılan görsəm, boynunu sındıracağam).

**9-10) (اَرَاَيْتَ الَّذ۪ي يَنْهٰىۙ عَبْدًا اِذَا صَلّٰىۜ) -** (Ey Məhəmməd), **mənə xəbər ver, görüm, o şəxs (Əbu Cəhl) istəyir ki, mənə qulluq edən sənin namazına mane olsun?**

**11) (اَرَاَيْتَ اِنْ كَانَ عَلَى الْهُدٰىۙ) Və mənə xəbər ver görüm,** (Əbu Cəhl) **hidayət yolundadır?** (Necə ki, özü inanır).

**12) (اَوْ اَمَرَ بِالتَّقْوٰىۜ) Yoxsa xeyri və təqvanı əmr edib, deyir ki, gərək bütlərə sitayiş edək?** (Necə ki, özünün etiqadıdır).

**13) (اَرَاَيْتَ اِنْ كَذَّبَ وَتَوَلّٰىۜ) Yoxsa mənə xəbər ver görüm, doğrudan da haqqı təkzib edib, doğru deyəndən üz döndərib?** (Necə ki, biz deyirik).

**14) (اَلَمْ يَعْلَمْ بِاَنَّ اللّٰهَ يَرٰىۜ) - Bəs bu halda** (Əbu Cəhl) **bilmir ki, Allah-Təala onun hər bir halına** (hidayət və zəlalətə) **agahdır, ona görə də ona cəza verəcəkdir?**

**15) (كَلَّا) - Əlbəttə, gərək** (Əbu Cəhl) **peyğəmbərimizə əzab və əziyyət etməkdən uzaq olsun. (لَئِنْ لَمْ يَنْتَهِ۬ لَنَسْفَعًا بِالنَّاصِيَةِۙ) - Əgər** (Əbu Cəhl) **peyğəmbərimizə istehza və əziyyət etməkdən* uzaq olmasa, əlbəttə, qüdrətimizlə onun alnından tutub əzab tərəfinə çəkərik və bizim qüdrətimizdən xilas ola bilməz.**

**(*Qeyd:** *“Əbu Cəhlin peyğəmbərə etdiyi əziyyət daha da artınca Allah-Təala onun yalançı alnından tutub Bədir çölünə çəkdi. O da qövmünü, Qüreyş camaatını köməyə çağırdı. Allah-Təala da fərraşlarını, islamın himayəçiləri olan Mədinə əhlini – Ənsarı və mühacirləri çağırıb Bədir adlı yerdə onları topladı. Əbu Cəhl və Qüreyşin rəislərinin də içində olduğu min nəfərlik silahlı, şücaətli ordunu 313 nəfərin əlində zəlil edib, bəzisini həlak, bəzisini əsir və yaralı etdi. Əbu Cəhl pis bir şəkildə öldürüldü. Bəs bu xəbər vədi doğru olan peyğəmbərimizin haqlı olmasına dəlil və sübut deyildirmi? Dəlil və sübutu belə aşkar olan ayələrə təfsirçilərin axirət əzabı mənası verməsi təəccüblüdür, səbəbi nədir?)*

نَاصِيَةٍ كَاذِبَةٍ خَاطِئَةٍۚ ﴿١٦﴾ فَلْيَدْعُ نَادِيَهُ ۙ﴿١٧﴾ سَنَدْعُ الزَّبَانِيَةَ ۙ﴿١٨﴾ كَلَّاۜ لَا تُطِعْهُ وَاسْجُدْ
وَاقْتَرِبْ ﴿١٩﴾

---

**16) (نَاصِيَةٍ كَاذِبَةٍ خَاطِئَةٍۚ) - Onun alnı yalançı, günahkar bir şəxsin alnıdır. Elə şəxsə nicat yoxdur.**

**17-18) (فَلْيَدْعُ نَادِيَهُ سَنَدْعُ الزَّبَانِيَةَ ۙ)** (Ey Məhəmməd) **biz** (Əbu Cəhlin) **alnını əzab etmək üçün tutanda, qoy məclisdə toplanan qövmünü - Qüreyş camaatını köməyə çağırsın. Biz də o vaxt fərraşlarımızı çağırıb, onları parça-parça edib, həlak edərik.**

**19) (كَلَّاۜ) Yox,** (Əbu Cəhlin) **sözləri haqq deyildir. (لَا تُطِعْهُ)** - (Ey Məhəmməd), **sən heç vaxt** (Əbu Cəhlin) **və onun kimi şəxslərə itaət etməyib, öz işində sabit və bərqərar ol.**

**(وَاسْجُدْ وَاقْتَرِبْ) Sən namazında olub, səcdə edib, səcdə səbəbinə Allah-Təalaya yaxınlaşmağa çalış.**

Allaha həmd olsun, əl-Ələq surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *“Kim əl-Ələq surəsini oxusa, kiçik surələrin hamısını oxuyan şəxsə verdiyi savab qədər Allah-Təala o şəxsə savab bəxş edər”*.

## əl-QƏDR SURƏSİ

97-ci surədir. Mədinədə nazil olub, 5 ayə, 30 kəlmə və 112 hərfdir.

إِنَّآ أَنْزَلْنَاهُ فِي لَيْلَةِ الْقَدْرِ ﴿١﴾ وَمَآ أَدْرٰيكَ مَا لَيْلَةُ الْقَدْرِ ﴿٢﴾ لَيْلَةُ الْقَدْرِ خَيْرٌ مِنْ أَلْفِ شَهْرٍ ﴿٣﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (إِنَّآ أَنْزَلْنَاهُ فِي لَيْلَةِ الْقَدْرِ)** - (Ey Məhəmməd), **həqiqətən, biz* bu Quranın əvvəlini Qədir gecəsində sənə nazil etmişik.** (Necə ki, sən özün bilirsən, lakin Qədir gecəsinin fəziləti sənə məlum deyildir).

**(*Qeyd:** *"Qədir gecəsi haqqında islam alimləri arasında ixtilaf vardır. Əksəriyyəti deyibdir ki, Ramazanın son on gecəsindən – tək gecələrindən biridir. Bunların da çoxu 27-ci gecəni Qədir gecəsi sayıb. Bir qrup alim də Ramazanın 19, 21, 23-cü gecələrindən birini Qədir gecəsi sayıb. Bunların da əksəriyyəti 23-cü gecəyə ehtimal veriblər. Nə isə, Qədir gecəsi Quranın hökmü ilə elə bir gecədir ki, o gecədə cümə və digər bayramlardakı kimi toplanıb, ibadət etmək savabdır, lakin gecənin hansı gecə olması peyğəmbərə həvalə olunubdur. Əlbəttə o cənabın bunu təyin etməsinə şəkk-şübhə yoxdur. Lakin əsl hədislərlə uydurma hədislər bir-birinə qarışdığından Qədir gecəsi qeyri-müəyyən hesab olunur.*

*Buna görə də Ramazanın son günlərindən hər hansı bir gecədə ibadət vəzifəsi yerinə yetirilsə, o savab əldə edilər. Lakin bu məsələdə ixtilaf etmək müsəlmanların parçalanmasına səbəb olur. Əlbəttə, bütün müsəlmanlar tək bir gecədə (məsələn, 27-ci gecədə) ittifaq etsələr, gözəl olar. Müsəlmanların birliyi daha da artar. Ramazan dualarına diqqət edəndə 27-ci günün duası o gecənin Qədir gecəsi olmasına işarə edir. Müxtəsər şəkildə desək, həccin, cümə gününün və digər bayramların təyin olunmasında şəriət sahibinin məqsədi nədirsə, Qədir gecəsinin də məqsədi odur).*

**2) (وَمَآ أَدْرٰيكَ مَا لَيْلَةُ الْقَدْرِ)** - (Ey Məhəmməd), **Qədir gecəsinin fəzilətini sənə nə bildirib? Gərək biz sənə bildirək. Budur sənə bəyan edirik.**

**3) (لَيْلَةُ الْقَدْرِ خَيْرٌ مِنْ أَلْفِ شَهْرٍ)** - (Ey Məhəmməd), **Qədir gecəsinin fəziləti min ay ibadət etməkdən yaxşıdır.** (Ayədən çıxan məna budur ki, Qədir gecəsinin fəziləti ibadət səbəbinə deyildir. Çünki Allah-Təalaya ibadət, qulluq etmək bütün məkan və zamanlarda gərək bərabər sayılsın. Əgər şəxs müvəhhid olub, riyakarlıq etməyib, sırf Allah üçün ibadət etsə, harda və nə zaman ibadət etmiş olmuş olsa, məqbuldur. İbadətin məqbul sayılıb, mükafat

تَنَزَّلُ الْمَلٰئِكَةُ وَالرُّوحُ فِيهَا بِإِذْنِ رَبِّهِمْ ۚ مِنْ كُلِّ اَمْرٍ ۙ ﴿٤﴾ سَلَامٌ ۛ هِيَ حَتّٰى مَطْلَعِ الْفَجْرِ ﴿٥﴾

---

verilməsinə zamanın dəxli yoxdur. O gecənin fəziləti möminlərin ittifaq edib, bir yerə toplanıb, din və dünya işlərinə dair sözlər danışıb, anlaşmaları səbəbi ilədir. Necə ki, həccin və cümə gününün və iki bayram gününün fəziləti bu birlik və ittifaqa görədir. Allah-Təala birlik və ittifaqa verdiyi əhəmiyyəti başqa heç bir şeyə verməyibdir. Heyf ki, biz müsəlmanlar qafil olmuşuq, Qədir gecəsinin fəzilətini dildə zikr edib, qəlbimiz qafil olub, yüz dəfə əyilib qalxmaqla, ya da ki, cövşəni-kəbir duasını tez-tələsik oxuyub, sözlərini qarışdırıb, cənnət yerinə cəhənnəm, nicat əvəzinə əzab istəyirik. Duanı ancaq qara gözlü hurilərə qovuşmaq üçün bir vasitə sayırıq. Allah, bu nə fərasət, bu nə ağıl, bu nə zəkadır? Camaatı aldadıb, Qədir gecəsinin həqiqətini onlara bildirməyib, bunun əksini təlim edənlərdən Allah-Təala intiqam alsın! Amin!).

**4) (تَنَزَّلُ الْمَلٰئِكَةُ وَالرُّوحُ فِيهَا بِإِذْنِ رَبِّهِمْ ۚ مِنْ كُلِّ اَمْرٍ ۙ) - O gecə möminlərin birlik və ittifaqına görə mələklər və** (Allah-Təalaya məxsus olub, Adəmə üflədiyi və peyğəmbərlərinə onunla qüvvət verdiyi) **Ruhülmüqəddəs** (Müqəddəs Ruh) **həmin gecə öz rəbbi Allah-Təalanın izni ilə hər bir işin** (əmrin) **xeyir və bərəkətini camaata yetirməkdən ötrü nazil olub, o toplantılarda möminlərlə birlikdə iştirak edib, onların yönəldikləri xeyir işlərə yardımçı olar.**

**5) (سَلَامٌ ۛ هِيَ حَتّٰى مَطْلَعِ الْفَجْرِ) - O gecə möminlərin toplanmasına görə xeyirli bir gecə olub, ta sübhə kimi Allah-Təalanın rəhməti möminlərə şamil olar. Gərək möminlər o gecənin fəzilətini qaçırtmasınlar.**

Allaha həmd olsun, əl-Qədr surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *“Kim əl-Qədr surəsini oxuyub, haqqını yerinə yetirsə, Ramazanda oruc tutub, Qədir gecəsini ibadətlə keçirən şəxsin savabı qədər Allah-Təala ona əcr və savab bəxş edər.”*

## əl-BEYYİNƏ SURƏSİ

98-cu surədir. Mədinədə nazil olub, 8 ayə, 94 kəlmə və 399 hərfdir.

لَمْ يَكُنِ الَّذِينَ كَفَرُوا مِنْ اَهْلِ الْكِتَابِ وَالْمُشْرِكِينَ مُنْفَكِّينَ حَتّٰى تَاْتِيَهُمُ الْبَيِّنَةُ ﴿١﴾ رَسُولٌ مِنَ اللّٰهِ يَتْلُوا صُحُفًا مُطَهَّرَةً ﴿٢﴾ فِيهَا كُتُبٌ قَيِّمَةٌ ﴿٣﴾ وَمَا تَفَرَّقَ الَّذِينَ اُوتُوا الْكِتَابَ اِلَّا مِنْ بَعْدِ مَا جَٓاءَتْهُمُ الْبَيِّنَةُ ﴿٤﴾ وَمَٓا اُمِرُوٓا اِلَّا لِيَعْبُدُوا اللّٰهَ مُخْلِصِينَ لَهُ الدِّينَ حُنَفَٓاءَ وَيُقِيمُوا الصَّلٰوةَ وَيُؤْتُوا الزَّكٰوةَ وَذٰلِكَ دِينُ الْقَيِّمَةِ ﴿٥﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (لَمْ يَكُنِ الَّذِينَ كَفَرُوا مِنْ اَهْلِ الْكِتَابِ وَالْمُشْرِكِينَ مُنْفَكِّينَ حَتّٰى تَاْتِيَهُمُ الْبَيِّنَةُ)** - (Ey Məhəmməd), **Qurana kafir olan kitab əhli və müşriklər sən göndərilmədən əvvəl deyirdilər: "Bizə Allah-Təaladan həqiqi, açıq-aşkar bir dəlil və sübut gəlincəyə qədər dinimizi tərk etmərik, ancaq o vaxt dinimizi tərk edib, ona tabe olarıq.**

**2-3) (رَسُولٌ مِنَ اللّٰهِ يَتْلُوا صُحُفًا مُطَهَّرَةً فِيهَا كُتُبٌ قَيِّمَةٌ) - O dəlil və sübut Allah-Təala tərəfindən gələn bir peyğəmbərdir ki, batildən pak və uca olub, haqq və ədalətə əmr edən ayələrin qeyd olunduğu səhifələri insanlara oxuyub, onları haqqa dəvət edəcəkdir. Belə bir** (peyğəmbər) **Allah-Təala tərəfindən göndərilən zaman biz də ona tabe olub, iman edərik. Kitab əhli və müşriklər belə dedilər.** (Ey Məhəmməd), **indi ki, Allah-Təala səni haqq və ədalətlə peyğəmbər göndərib, açıq-aydın ayələri ehtiva edən Qurani-Şərif kimi kitabı sənə veribdir, yenə də öz sözlərinə əməl etməyib, haqqı tərk edib Qurana iman etmədilər.**

**4) (وَمَا تَفَرَّقَ الَّذِينَ اُوتُوا الْكِتَابَ اِلَّا مِنْ بَعْدِ مَا جَٓاءَتْهُمُ الْبَيِّنَةُ)** - (Ey Məhəmməd), **kitab əhli olmayan müşriklərin sənin peyğəmbərliyində ixtilaf etmələrindənsə kitab əhlinın** (yəhudi və xristianların) **ixtilaf etmələri daha təəccüblüdür. Onlar ancaq sənin kimi peyğəmbərliyi dəlil, sübut** (Quran) **ilə isbat olunan biri onlara gələndən sonra ixtilaf etdilər, halbuki onlar kitab əhli olub, sənin xəbərin onların kitablarında qeyd edildiyindən gərək ixtilaf etməyib, sənin peyğəmbərliyini qəbul edəydilər. Amma onlar özlərini müşriklərlə bərabər tutub ixtilaf etdilər.**

**5) (وَمَٓا اُمِرُوٓا اِلَّا لِيَعْبُدُوا اللّٰهَ مُخْلِصِينَ لَهُ الدِّينَ حُنَفَٓاءَ وَيُقِيمُوا الصَّلٰوةَ وَيُؤْتُوا الزَّكٰوةَ وَذٰلِكَ دِينُ الْقَيِّمَةِ) Və halbuki kitab əhli** (Tövrat və İncildə) **bütün batillərdən vaz keçib,**

إِنَّ الَّذِينَ كَفَرُوا مِنْ اَهْلِ الْكِتَابِ وَالْمُشْرِكِينَ فِي نَارِ جَهَنَّمَ خَالِدِينَ فِيهَا ۚ اُولٰٓئِكَ هُمْ شَرُّ الْبَرِيَّةِ ۜ
﴿٦﴾ اِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ اُولٰٓئِكَ هُمْ خَيْرُ الْبَرِيَّةِ ۜ ﴿٧﴾ جَزَٓاؤُ۬هُمْ عِنْدَ رَبِّهِمْ جَنَّاتُ
عَدْنٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَٓا اَبَدًا ۜ رَضِيَ اللّٰهُ عَنْهُمْ وَرَضُوا عَنْهُ ۚ ذٰلِكَ لِمَنْ خَشِيَ
رَبَّهُ ﴿٨﴾

---

**din və imanlarını yeganə Allah-Təalaya məxsus edib, namaz qılıb, zəkat verməklə əmr olunmuşdular. Düz və möhkəm olan ümmətin din və ayini budur. Bu** (Məhəmməd) **də həmin din və ayini əmr edir. Amma kitab əhli belə din və ayini tərk edib,** (Məhəmmədə) **kafir oldular.**

**6) (اِنَّ الَّذِينَ كَفَرُوا مِنْ اَهْلِ الْكِتَابِ وَالْمُشْرِكِينَ فِي نَارِ جَهَنَّمَ خَالِدِينَ فِيهَا ۚ اُولٰٓئِكَ هُمْ شَرُّ الْبَرِيَّةِ ۜ)** - (Ey Məhəmməd), **həqiqətən, Qurana kafir olan kitab əhli və müşriklər axirətdə cəhənnəm odunda həmişə əzabda olacaqlar.** (Məxluqatın pis olanı əlbəttə həmişə əzabda olanlardır).

**7) (اِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ اُولٰٓئِكَ هُمْ خَيْرُ الْبَرِيَّةِ ۜ) Və həqiqətən, o şəxslər ki,** (Qurana) **iman edib, xeyir əməl edir, əlbəttə məxluqatın yaxşısı onlardır.**

**8) (جَزَٓاؤُ۬هُمْ عِنْدَ رَبِّهِمْ جَنَّاتُ عَدْنٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَٓا اَبَدًا ۜ) Xeyir əməl edənlərin mükafatı axirətdə öz rəbləri Allah-Təalanın yanında olub, ağaclarının və qəsrlərinin altından çaylar axan, nemətləri həmişəlik olan cənnətlərdə o nemətlərin içində olacaqlar. (رَضِيَ اللّٰهُ عَنْهُمْ وَرَضُوا عَنْهُ ۚ) Allah-Təala onlardan razı olub əməllərini qəbul edəcək, onlar da Allah-Təalanın verdiyi əcr və savaba razı olacaqlar. (ذٰلِكَ لِمَنْ خَشِيَ رَبَّهُ) Allah-Təalanın bu məmnunluğu elə şəxslərdən ötrüdür ki, onlar öz rəbləri Allah-Təalanın əzabından qorxub, din və imanlarında səbat edib, batinlərini xəbis sifətlərdən pak edib, zahirlərini də insanlıq sifətləri ilə bəzəyirlər.**

Allaha həmd olsun, əl-Beyyinə surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *“Kim əl-Beyyinə surəsini oxusa, qiyamət günündə məxluqların yaxşısı ilə yoldaş olar.”*

## əz-ZİLZAL SURƏSİ

99-cu surədir. Məkkədə nazil olub, 8 ayə, 35 kəlmə və 149 hərfdir.

اِذَا زُلْزِلَتِ الْاَرْضُ زِلْزَالَهَاۙ ﴿١﴾ وَاَخْرَجَتِ الْاَرْضُ اَثْقَالَهَاۙ ﴿٢﴾ وَقَالَ الْاِنْسَانُ مَا لَهَاۚ ﴿٣﴾ يَوْمَئِذٍ
تُحَدِّثُ اَخْبَارَهَاۙ ﴿٤﴾ بِاَنَّ رَبَّكَ اَوْحٰى لَهَاۜ ﴿٥﴾ يَوْمَئِذٍ يَصْدُرُ النَّاسُ اَشْتَاتًا لِيُرَوْا اَعْمَالَهُمْۜ ﴿٦﴾
فَمَنْ يَعْمَلْ مِثْقَالَ ذَرَّةٍ خَيْرًا يَرَهُۜ ﴿٧﴾ وَمَنْ يَعْمَلْ مِثْقَالَ ذَرَّةٍ شَرًّا يَرَهُ﴿٨﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (اِذَا زُلْزِلَتِ الْاَرْضُ زِلْزَالَهَاۙ)** - (Ey Məhəmməd), **o zaman ki, Allah- Təalanın hikmət və iradəsi ilə yerə məxsus olan zəlzələ ilə - hansı ki, ondan sonra bir daha elə zəlzələ olmayacaqdır, bir zəlzələ oldu,** (bu zəlzələylə yer kürəsinin ömrü sona çatıb, əslinə qovuşmaq vaxtı gəlib, ondan sonra qiyamət qopacaqdır).

**2) (وَاَخْرَجَتِ الْاَرْضُ اَثْقَالَهَاۙ) - Bu zəlzələ səbəbi ilə yer öz bətnində olan hər bir dəfinə, xəzinə, mədənlər və ölülərin hamısını çıxarıb, dünyaya gətirəcəkdir.** (Zəlzələdən meydana gələn titrəmə səbəbi ilə ilə yerdə sarsıntı meydana gəlib, yerin bətnində olan bütün əşyalar zahir olacaqdır).

**3) (وَقَالَ الْاِنْسَانُ مَا لَهَاۚ) Yer üzündə məskun olan insan zəlzələnin şiddətindən iztiraba düşüb,** (necə ki, cüzi zəlzələdə də müşahidə olunur) deyər: “Bu yerə nə olubdur ki, belə şiddətli zəlzələ edir? (Şiddətlə qorxar).

**4) (يَوْمَئِذٍ تُحَدِّثُ اَخْبَارَهَاۙ) Elə ki, yer zəlzələ edib, qiyamət başlayar, haqq-hesab, cəza, intiqam xəbərlərini verib, məhşər əhli də agah olarlar.**

**5) (بِاَنَّ رَبَّكَ اَوْحٰى لَهَاۜ)** - (Ey Məhəmməd), **o xəbərləri ki, yer verir, o xəbərləri sənin rəbbin Allah-Təala yerə vəhy edibdir.** (Dünyada baş verən dəhşətli hadisələr qorxunc olayların baş verəcəyinə dəlil olduğu kimi axirət zəlzələsi də ondan sonra dəhşətli hadisələrin meydana gələcəyini hal dili ilə xəbər verib, dəlil, sübut olar).

**6-7) (يَوْمَئِذٍ يَصْدُرُ النَّاسُ اَشْتَاتًا لِيُرَوْا اَعْمَالَهُمْۜ) Zəlzələdən sonra o zamanda** (insanlar) **müxtəlif surətlərlə** (möminlərin üzləri nurani, fasiqlərin üzləri zülmət kimi) **öz əməllərini görmək üçün qəbirlərindən çıxarlar.**

**(فَمَنْ يَعْمَلْ مِثْقَالَ ذَرَّةٍ خَيْرًا يَرَهُ) Kim ki, bir zərrə ağırlığı qədər dünyada xeyir əməl edibsə, o əməlini görüb, agah olar ki, filan vaxt bu əməli edibdir.**

**8) (وَمَنْ يَعْمَلْ مِثْقَالَ ذَرَّةٍ شَرًّا يَرَهُ) Və kim ki, bir zərrə ağırlığı qədər şər əməl**

**edibsə, o əməlini görüb, agah olar ki, filan vaxt bu əməli edibdir.** (Allah-Təala öz kamil qüdrəti ilə insanların bütün əməllərini qeyd edib, saxlayıb, hər bir şəxsin əməlinə qarşılıq verəcəyi üçün bütün insanların xeyrir əməllərə yönəlib, bir-birilərinə yaxşılıq edib, qardaş kimi rəftar etmələri insanlığın ən gözəl və əsas şərti deyildirmi? Biz islam ümməti belə gözəl ayələri tərk etməklə özümüzü vəhşi heyvan surətinə salmaqdan, günah və əzab qazanmaqdan və Allah-Təalanın yanında üzümüzü qaraltmaqdan başqa nə əldə edirik? Bunların hamısının səbəbi cəhalətdir. Dəfələrlə demişəm yenə də deyirəm Qurani-Şərifə sarılıb, özümüzü elm əhli zümrəsinə daxil edib, zahir və batinimizi nur elmi ilə bəzəmədikcə, insanlığı dərk etməyib, heyvanlıq aləmində qalacağıq).

Allaha həmd olsun, Zilzal surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim Zilzal surəsini dörd dəfə oxusa, bütün Quranı oxumuş kimidir".*

## əl-ADİYAT SURƏSİ

100-cü surədir. Məkkədə nazil olub, 11 ayə, 40 kəlmə və 163 hərfdir.

وَالْعَادِيَاتِ ضَبْحًاۙ ﴿١﴾ فَالْمُورِيَاتِ قَدْحًاۙ ﴿٢﴾ فَالْمُغِيرَاتِ صُبْحًاۙ ﴿٣﴾ فَاَثَرْنَ بِهٖ نَقْعًاۙ ﴿٤﴾
فَوَسَطْنَ بِهٖ جَمْعًاۙ ﴿٥﴾ اِنَّ الْاِنْسَانَ لِرَبِّهٖ لَكَنُودٌۚ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (وَالْعَادِيَاتِ ضَبْحًاۙ) And olsun kafirlərlə və müşriklərlə cihad edənlərin o atlarına ki, cihadda hücum edib, şiddətlə nəfəs alırlar.**

**2) (فَالْمُورِيَاتِ قَدْحًاۙ) - O atlar cihad vaxtı ayaqlarını daşlara vurub, qığılcım qoparırlar.**

**3) (فَالْمُغِيرَاتِ صُبْحًاۙ) Sübh vaxtı qəfildən müşriklərin üstünə gedib, əsir və qarət edirlər.**

**4-5) (فَاَثَرْنَ بِهٖ نَقْعًاۙ فَوَسَطْنَ بِهٖ جَمْعًاۙ) - O zaman hərəkətləri ilə toz-duman qaldırıb, o tozun səbəbinə müşriklərin içinə daxil olub, cihadla məşğul olurlar.** (Bunlara and olsun)

**(*Qeyd:** *Müşriklərdən dinə və müsəlmanlara bir zərər gələn zaman düşməni dəf edib, cihad etmək ən vacib dini əməl hesab olunur. Cihadın fəziləti və onda olan faydalara işarə etməkdən ötrü Allah-Təala bu ayədə mücahidlərin atlarına and içir. Yəni mücahidlərin nəinki özləri, hətta atlarının fəziləti elə bir səviyyədədir ki, onlara and içmək layiqdir. İslam ümməti bundan gərək ibrət alsın. Lakin müşriklərdən, digər din və millətlərdən müsəlmanlara və islama bir zərər gəlmirsə, onlarla sülh içində olub, insaf və mürüvvət üzrə rəftar etmək lazımdır. Şəriət sahibi olan uca peyğəmbərin savaşları buna dəlildir. Çünki peyğəmbərin bütün savaşlarında ilk hücum edən tərəf hər zaman onun düşmənləri olubdur. Çünki Quran nazil olandan sonra heç bir xalqı zorla islama daxil etmək caiz olmayıb, müsəlman olub, olmamaq insanların öz ixtiyarına buraxılıbdır. "Dində məcburiyyət yoxdur" ayəsi buna sübutdur).*

**6) (اِنَّ الْاِنْسَانَ لِرَبِّهٖ لَكَنُودٌۚ) Allah-Təala qazilərin atlarına and içəndən sonra buyurur:** (Ey Məhəmməd), **həqiqətən, insan Allah-Təalanın nemətlərinə* şiddətlə küfr edən nankordur.**

**(*Qeyd:** *"İnsanın vücudu Allah-Təalanın böyük bir neməti olan kimi onun orqanlarının hər biri də ayrı bir nemətdir. Həqiqətən, Allah-Təalanın insana iki*

وَاِنَّهُ عَلٰى ذٰلِكَ لَشَهٖيدٌۚ ﴿٧﴾ وَاِنَّهُ لِحُبِّ الْخَيْرِ لَشَدٖيدٌۜ ﴿٨﴾ اَفَلَا يَعْلَمُ اِذَا بُعْثِرَ مَا فِي الْقُبُورِۙ ﴿٩﴾
وَحُصِّلَ مَا فِي الصُّدُورِۙ ﴿١٠﴾ اِنَّ رَبَّهُمْ بِهِمْ يَوْمَئِذٍ لَخَبٖيرٌ ﴿١١﴾

---

*cür nemәti vardır: "Biri daxili (insanın bәdәni vә bәdәnindә olan orqanlar), ikincisi xarici, yәni bәdәnin xaricindәki, möhtac olduğu şeylәr. Nemәtә şükür etmәk, hәr bir nemәti Allah-Tәalanın istәdiyi şәkildә istifadә etmәkdәn ibarәtdir. İnsanın bәdәnindә olan daxili nemәtlәri Allah-Tәala istәyәn kimi tövhid, elm, xeyir, nәfsi kamillәşdirmәk, gözәl әxlaq әldә etmәk vә digәr xeyir işlәrdә istifadә etmәk o nemәtin haqqını yerinә yetirib, şükür etmәkdir. Vә yenә xarici nemәtlәri, mәsәlәn, әn әziz olan dünya malını Allah-Tәalanın әmr etdiyi şәkildә, mәsәlәn, mәscid, mәktәb, xәstәxana, qocalar vә yetimlәr evi, iş yerlәri vә digәr xeyirli qurumlar tikib, ora sәrf etmәk, millәtin ehtiyacını hәll edib, әskikliklәrini tamamlamaq, müsәlmanların xeyri yolunda xәrclәmәk o nemәtә şükür etmәk demәkdir. Lakin bunların әksini etmәk o nemәtә nankorluq edib, Allah-Tәalanın әmr vә fәrmanına qarşı çıxmaq demәkdir).*

**7) (وَاِنَّهُ عَلٰى ذٰلِكَ لَشَهٖيدٌۚ) Vә hәqiqәtәn, insan öz nankorluğuna şahiddir.**

**8-9) (وَاِنَّهُ لِحُبِّ الْخَيْرِ لَشَدٖيدٌۜ اَفَلَا يَعْلَمُ اِذَا بُعْثِرَ مَا فِي الْقُبُورِۙ) Vә hәqiqәtәn, insan dünya malı toplamağa çox hәrisdir vә bu sәbәbdәn xәrclәmәkdә xәsislik edir.**

**10) (وَحُصِّلَ مَا فِي الصُّدُورِۙ)** - (Ey Mәhәmmәd), **bәs insan bilmir ki,** (әlbәttә, gәrәk bilib, etiqad etsin) **qәbirlәrdә olanlar dirilib, oradan çıxacaq vә qәlblәrdә olan sirlәr ortaya çıxıb, xeyir vә şәr bir-birindәn ayrılacaq?** (Xeyrә xeyir, şәrә şәr qarşılığı vermәkdәn ötrü Allah-Tәala insanları dirildib, mәhşәrә gәtirib, hamısının әmәllәrini göstәrәcәk).

**11) (اِنَّ رَبَّهُمْ بِهِمْ يَوْمَئِذٍ لَخَبٖيرٌ) Hәqiqәtәn, Allah-Tәala o gün** (qiyamәtdә) **onların bütün hal vә әmәllәrinә agahdır vә hamısına qarşılıq verәcәkdir.**

Allaha hәmd olsun, әl-Adiyat surәsinin tәfsiri tamamlandı. Allahın Rәsulu (ә.s) buyurdu: *"Kim әl-Adiyat surәsini oxusa, Allah-Tәala ona on savab bәxş edәr."*

## əl-QARİƏ SURƏSİ

101-ci surədir. Məkkədə nazil olub, 11 ayə, 36 kəlmə və 152 hərfdir.

اَلْقَارِعَةُ ﴿١﴾ مَا الْقَارِعَةُ ﴿٢﴾ وَمَآ اَدْرٰيكَ مَا الْقَارِعَةُ ﴿٣﴾ يَوْمَ يَكُونُ النَّاسُ كَالْفَرَاشِ الْمَبْثُوثِ ﴿٤﴾
وَتَكُونُ الْجِبَالُ كَالْعِهْنِ الْمَنْفُوشِ ﴿٥﴾ فَاَمَّا مَنْ ثَقُلَتْ مَوَازِينُهُ ﴿٦﴾ فَهُوَ فِي عِيشَةٍ رَاضِيَةٍ ﴿٧﴾
وَاَمَّا مَنْ خَفَّتْ مَوَازِينُهُ ﴿٨﴾ فَاُمُّهُ هَاوِيَةٌ ﴿٩﴾ وَمَآ اَدْرٰيكَ مَا هِيَهْ ﴿١٠﴾ نَارٌ حَامِيَةٌ ﴿١١﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (اَلْقَارِعَةُ)** - (Ey Məhəmməd), **insanların qəlbini titrədən şiddətli, dəhşətli bir müsibətdən və bəladan sənə xəbər verim.**

**2) (مَا الْقَارِعَةُ)** - (Ey Məhəmməd), **o bəla nədir? Dəhşət və şiddətdə bütün bəlalardan üstündür.**

**3) (وَمَآ اَدْرٰيكَ مَا الْقَارِعَةُ)** - (Ey Məhəmməd), **bu bəlanın həqiqətini və mahiyyətini sən nə bilirsən? O bəlanı görməyincə onun həqiqətinə agah olmaq müşküldür.**

**4) (يَوْمَ يَكُونُ النَّاسُ كَالْفَرَاشِ الْمَبْثُوثِ) - O gün ki,** (qiyamət günü) **insanları qorxu bürüyüb, acizliklərindən mığmığa kimi bir-birinin üstünə tökülüb, səpələnər,**

**5) (وَتَكُونُ الْجِبَالُ كَالْعِهْنِ الْمَنْفُوشِ) və o gün ki dağlar didilmiş yun kimi parça-parça olub, hər bir tərəfə dağılar, elə bir gündə o bəla və müsibət zahir olar.** (Asilərə əzab etməyə işarədir).

**6-7) (فَاَمَّا مَنْ ثَقُلَتْ مَوَازِينُهُ فَهُوَ فِي عِيشَةٍ رَاضِيَةٍ)** - (Ey Məhəmməd), **amma kimin ki, o gün xeyir əməllərinin çəkisi ağır olub, dünyada etdiyi gözəl əməllərlə dolu olsa, o şəxs yaxşı və gözəl güzəran içində olub, razı qalacağı şəkildə istirahət edəcək.**

**8-9) (وَاَمَّا مَنْ خَفَّتْ مَوَازِينُهُ فَاُمُّهُ هَاوِيَةٌ) Amma kimin ki, çəkisi yüngül olub, onda xeyir əməl görünməsə, o şəxs başı üstə cəhənnəmin dibinə gedib, orada əzaba düçar olacaq.**

**10-11) (وَمَآ اَدْرٰيكَ مَا هِيَهْ نَارٌ حَامِيَةٌ)** - (Ey Məhəmməd), **cəhənnəmin dibinin həqiqətini sən nə bilirsən? Onun həqiqətini bilməzsən, o elə bir şiddətli alovdur ki, ondan daha qaynar atəş ola bilməz.**

Allaha həmd olsun, əl-Qariə surəsinin təfsiri tamamlandı Allahın Rəsulu (ə.s) buyurdu: *“Kim əl-Qariə surəsini oxusa, Allah- Təala qiyamət günündə onun xeyir əməl çəkisini o surə ilə ağır edər.”*

## ət-TƏKASÜR SURƏSİ

102-ci surədir. Məkkədə nazil olub, 8 ayə, 28 kəlmə və 120 hərfdir.

اَلْهٰيكُمُ التَّكَاثُرُ ﴿١﴾ حَتّٰى زُرْتُمُ الْمَقَابِرَ ﴿٢﴾ كَلَّا سَوْفَ تَعْلَمُونَ ﴿٣﴾ ثُمَّ كَلَّا سَوْفَ تَعْلَمُونَ
﴿٤﴾ كَلَّا لَوْ تَعْلَمُونَ عِلْمَ الْيَقِينِ ﴿٥﴾ لَتَرَوُنَّ الْجَحِيمَ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1-2) (اَلْهٰيكُمُ التَّكَاثُرُ حَتّٰى زُرْتُمُ الْمَقَابِرَ) Siz insanları dünya malının çoxluğu ilə iftixar etmək Allah-Təaladan ayırıb, xeyir əməllərdən saxladı. Malın çoxluğundan din və millətə münasib bir xidmət etməyib, ancaq malın çox olması ilə bir-birinizə təkəbbürlənib, özünüzü tərifləməklə məşğul oldunuz. Ta o vaxta kimi ki, ölüm sizə gəlib, qəbirləri ziyarət edib yer evinə daxil oldunuz. Sizin adətiniz ölənə kimi həmişə belə olub, ölüncə bu adətiniz də bitdi.** (Halbuki dünya malı elə bir pis şeydir ki, onunla iftixar etmək insanlıqdan kənar bir işdir).

Dünya malı o vaxt yaxşı və gözəl bir şey olar ki, Allah-Təalanın vacib və savab qıldığı haqqları yerinə yetirib, həm də din və millətin əskikliklərini tamamlamaq yolunda sərf olunsun. Hansı dünya malı ki, Allah-Təalanın verdiyi əmrlər yolunda sərf olunmayıb, sandıqlarda və anbarlarda saxlanılır, onunla saxsı qab-qacaq arasında bir fərq olmayıb, axirətdə sahibini ilahi əzaba düçar edəcəkdir.

**3) (كَلَّا) - Əlbəttə, dünya malı ilə bir-birinizə qarşı iftixar etməyi tərk edin. (سَوْفَ تَعْلَمُونَ) - Əlbəttə, ölüm vaxtında iftixar etmənin aqibətinin pis olmasına və çox malın sizə faydası olmadığına agah olacaqsınız.**

**4) (ثُمَّ كَلَّا سَوْفَ تَعْلَمُونَ) Yenə təkid edib, sizə əmr edirəm. Malın çoxluğu ilə iftixar etməyi tərk edin. Əlbəttə, ölüm vaxtında onun pis aqibətinə agah olacaqsınız. O vaxt peşman olacaqsınız, lakin peşmanlıq fayda verməyəcəkdir.**

**5) (كَلَّا لَوْ تَعْلَمُونَ عِلْمَ الْيَقِينِ) - Əlbəttə, iftixar etməyi tərk edin. Əgər siz aqibətinizə tam agah olsaydınız, hər halda malın çoxluğu ilə iftixar etmək sizi Allah-Təalanın əmrlərindən ayırmaz idi. Gözəl əməllər edərdiniz. Lakin zəlalət və cəhalət sizi insanlıq aləmindən kənar edibdir.**

**6) (لَتَرَوُنَّ الْجَحِيمَ) And olsun müqəddəs zatıma, siz dünya malı ilə iftixar**

ثُمَّ لَتَرَوُنَّهَا عَيْنَ الْيَقِينِ ﴿٧﴾ ثُمَّ لَتُسْـَٔلُنَّ يَوْمَئِذٍ عَنِ النَّعِيمِ ﴿٨﴾

---

**edib, mal toplayıb, anbarlarda yığanlar əlbəttə bizim əzab evimiz olan cəhənnəmi görəcəksiniz.**

**7) (ثُمَّ لَتَرَوُنَّهَا عَيْنَ الْيَقِينِ) - Ondan sonra cəhənnəmi mütləq görüb, oraya daxil olacağınıza tam inanacaqsınız.**

**8) (ثُمَّ لَتُسْـَٔلُنَّ يَوْمَئِذٍ عَنِ النَّعِيمِ) - Ondan sonra həmin gün** (qiyamət günü) **Allah-Təalanın sizə verdiyi nemətlərdən sorğu-sual* olunacaqsınız.**

**(*Qeyd:** *"Mütarrif ibn Abdullah ibn Şixxir atası Abdullahdan rəvayət edib deyir: "Bir gün peyğəmbərin (ə.s) hüzuruna getdim, gördüm Təkasür surəsini oxuyur. Ondan sonra buyurdu: "Adəm övladı deyir: "Mənim malım, mənim malım, sənin malından sənə heç bir fayda yoxdur. Ancaq malından sədəqə və ehsan edib, Allah-Təalaya göndərsən, ya da ki, yeyib qurtarasan, ya da ki, geyib köhnəldəsən, əski edəsən, bundan başqa o maldan sənə bir fayda olmaz. Varislərə saxladığın ancaq günah və əzabdır. Hədisin mənası budur ki, əgər dünyada malını bu üç şeydə sərf etsən, birincisi əbədidir, axırıncı ikisi isə puç olub, sənə bir fayda verməyəcəkdir. Ancaq son ikisini sərf etsən, hər ikisi puç olduğu üçün sənə heç bir fayda verməyib, axirətdə onun-bunun əlinə baxacaqsan. Ancaq varislərin ondan faydalanacaqdır. Başqa bir hədisdə Ənəs ibn Malik peyğəmbərdən (ə.s) hədis nəql edib deyir: "O cənab buyurdu: "Meyitə üç şeyi tabe olur. İkisi qayıdıb dünyada qalır, biri onunla qəbrə daxil olub, həmişə onunla qalır. Bu üç şey: "Malı, ailəsi və əməlidir. Malı, ailəsi qayıdıb dünyada qalırlar (Buxari, Riqaq, 42; Müslüm, Zühd, 5). Lakin əməli onunla qalar və axirətin hər bir dəhşətli məqamlarında ona fayda (və ya ziyan) verər. Peyğəmbər doğru buyurdu).*

Allaha həmd olsun, Təkasür surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim Təkasür surəsini oxusa, Allah-Təala ona Qurani-Şərifdən min ayə oxuyanın savabını bəxş edər."*

## əl-ƏSR SURƏSİ

103-cü surədir. Məkkədə nazil olub, 3 ayə, 14 kəlmə və 68 hərfdir.

وَالْعَصْرِ ۙ ﴿١﴾ اِنَّ الْاِنْسَانَ لَفِي خُسْرٍ ۙ ﴿٢﴾ اِلَّا الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ وَتَوَاصَوْا بِالْحَقِّ وَتَوَاصَوْا بِالصَّبْرِ﴿٣﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1-2) (**وَالْعَصْرِ ۙ اِنَّ الْاِنْسَانَ لَفِي خُسْرٍ ۙ**) And olsun bu əsrə** (bu zəmanəyə) **ki,** (Məhəmməd ibn Abdullahın) **zühur etməyi ilə elm və mərifətin günəşi Məhəmməd həqiqətinin üfüqündən doğub, zəlalət və cəhalətin qaranlıqlarını məhv edib, geri çəkməyə başladı. Lakin insan yarasa kimi nurun idrakından məhrum qalıb, öz nəfsinə zərər və ziyan etməkdədir.**

**3) (**اِلَّا الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ وَتَوَاصَوْا بِالْحَقِّ وَتَوَاصَوْا بِالصَّبْرِ**) Ancaq o şəxslər ki, zəlalət və cəhalət pərdəsini yırtıb, Qurani-Şərifə və uca peyğəmbərə** (Məhəmmədə) **iman edib, gözəl əməllər eyləyir, tövhid və islamda möhkəm olub, Qurani-Şərifin ehkamına sarılmaqda və habelə islamın yayılmasında hər bir bəlaya düçar olmağa səbir və səbat edib, bir-birlərini təşviq edirlər, onlar nəfslərinə xeyir verib, bizim tərəfimizdən böyük əcr və savaba yetişəcəklər.**

Allaha həmd olsun, əl-Əsr surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim əl-Əsr surəsini oxusa, Allah-Təala onu bağışlayıb, haqqı və səbri tövsiyə edənlərdən sayar."*

## əl-HUMƏZƏ SURƏSİ

104-cü surədir. Məkkədə nazil olub, 9 ayə, 30 kəlmə və 130 hərfdir.

وَيْلٌ لِكُلِّ هُمَزَةٍ لُمَزَةٍۙ ﴿١﴾ اَلَّذِي جَمَعَ مَالًا وَعَدَّدَهُۙ ﴿٢﴾ يَحْسَبُ اَنَّ مَالَهُ اَخْلَدَهُۚ ﴿٣﴾ كَلَّا
لَيُنْبَذَنَّ فِي الْحُطَمَةِۘ ﴿٤﴾ وَمَٓا اَدْرٰيكَ مَا الْحُطَمَةُۜ ﴿٥﴾ نَارُ اللّٰهِ الْمُوقَدَةُۙ ﴿٦﴾ اَلَّتِي تَطَّلِعُ عَلَى
الْاَفْئِدَةِۜ ﴿٧﴾ اِنَّهَا عَلَيْهِمْ مُؤْصَدَةٌۙ ﴿٨﴾ فِي عَمَدٍ مُمَدَّدَةٍ ﴿٩﴾

---

### Bismillahir-Rəhmanir-Rəhim

**1) (وَيْلٌ لِكُلِّ هُمَزَةٍ لُمَزَةٍۙ)** - (Ey Məhəmməd), İnsanlara eyib tutub, irz-namuslarına əl uzadıb, qeybət edib, tənə edən hər kəsə əzab olunsun. (Yəni onlardan ötrü əzab hazırlanıbdır).

**2) (اَلَّذِي جَمَعَ مَالًا وَعَدَّدَهُ) Eyib tutanların sifətlərindən biri budur ki, mal toplayıb, tələf olmağından qorxub, hər fürsətdə onu davamlı sayar.**

**3) (يَحْسَبُ اَنَّ مَالَهُ اَخْلَدَهُ) Elə zənn eyləyir ki, onun malı dünyada əbədi qalıb, ölüm ona gəlməyəcəkdir.** (Hərçənd dünyada ölümü inkar edən heç kim yoxdur, lakin bu şəxslərin əməlləri sanki dünyada həmişə yaşayacaqlarını zənn etdiklərini göstərir).

**4) (كَلَّا لَيُنْبَذَنَّ فِي الْحُطَمَةِۘ) - Əlbəttə, varlı şəxs dünyada əbədi qalacağını zənn etməsin. Əlbəttə, o zənninə görə Hütəməyə** (cəhənnəmin alt qatı) **atılacaqdır.**

**5) (وَمَٓا اَدْرٰيكَ مَا الْحُطَمَةُ)** - (Ey Məhəmməd), **hütəmənin nə olduğunu nə bilirsən?**

**6-7) (نَارُ اللّٰهِ الْمُوقَدَةُۙ اَلَّتِي تَطَّلِعُ عَلَى الْاَفْئِدَةِۜ)** (Hütəmə) **Allah-Təalanın alovlu yanan bir atəşidir ki, insanın qəlbinin batinini əhatə edib, şiddətli əzab edər.**

**8-9) (اِنَّهَا عَلَيْهِمْ مُؤْصَدَةٌۙ فِي عَمَدٍ مُمَدَّدَةٍ) - O alovlu yanan atəş hər bir tərəfdən onları tutub, qapılar onlara bağlanıb, qapılara sütunlar çəkilib, möhkəm bağlanacaq ki, əbədiyyən oradan çıxmağa qadir olmasınlar.** (Belə ifadələr cəhənnəm əhlinin əzabını təsvir etmək onların əzabının nə dərəcədə şiddətli olacağını bizə bildirmək üçündür, yoxsa axirət əzabının həqiqətini dərk etmək imkansızdır).

Allaha həmd olsun, əl-Huməzə surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim əl-Huməzə surəsini oxusa, Allah-Təala ona on savab bəxş edər."*

# əl-FİL SURƏSİ

105-ci surədir. Məkkədə nazil olub, 5 ayə, 20 kəlmə və 96 hərfdir.

**Bismillahir-Rəhmanir-Rəhim**

Ərəb tarixçilərinin rəvayətinə görə Əbrəhə ibn əs-Səbbah ibn əl-Əşrəm adlı bir şəxs Yəməndə padşah idi. Lakin Həbəş sultanı Nəcaşiyə tabe idi. Səna şəhərində böyük bir kilsə tikib, istədi ərəbləri Kəbəyə ziyarətdən vaz keçirib, bu kilsənin ziyarətinə toplasın. O kilsənin adını Qülleys qoydu. Ərəblər bu xəbəri eşidincə, Bəni-Kinanə camaatından Malik adlı bir kişi bu kilsənin ziyarətinə getdi. Gedib Sənaya çatıb, kilsəni ziyarət edəndən sonra kilsə xidmətçilərinə gecə kilsədə yatmağa nəzir etdiyini deyib, onların izni ilə gecə kilsədə qaldı. Elə ki, gecədən bir qədər keçdi, yatanlar yatıb, ara sakitləşib, kilsə boşalınca, Malik elə orada böyük ayaqyolunu edib, nəcisini kilsənin divarlarına, zinətlərinə sürtüb, gecə vaxtı aradan çıxıb qaçdı. Elə ki, səhər açıldı, xidmətçilər məsələdən agah olub, Əbrəhəyə xəbər verdilər. Əbrəhə Kəbəni dağıdıb, xarabaya çevirəcəyinə and içdi. Qoşunu toplayıb, bir neçə savaş fili, o cümlədən Mahmud adlı savaşlarda sınanmış nəhəng bir fili götürüb, Məkkəyə hücum etdi. Ərəb yarımadasında məskun olan ərəblər Əbrəhənin niyyətinə agah olub, onunla savaşıb, Kəbənin mühafizə etməyi özlərinə vacib bilib, müharibəyə hazırlaşdılar. Ərəblərin əyanlarından Zunəfər (Zunəfr) adlı biri qoşunla Əbrəhənin qarşısına çıxıb savaşsa da, məğlub olub, əsir düşdü. Ondan sonra Xasəm torpağında Nüfeyl ibn Həbib onunla savaşmağa çıxdı. Nüfeylin qoşununu da dağıdıb, Nüfeyli əsir etdi. Sonra gedib Taifə yetişdi. Taifin rəisi Məsud ibn Müğeys (Müəttəb) onun qarşısına çıxıb dedi: "Ey məlik, biz hamımız sənin qulunuq, sənin itaətində olub, sənə müxalif deyilik. Budur, bu şəxsi sənə bələdçi verdik, mahir bir şəxsdir, səni Məkkəyə tərəf aparsın. Əbu Riğal adlı bir kişini ona bələdçi verdilər. Getdilər, Müğəmmis adlı bir yerə çatanda Əbu Riğal orada həlak oldu. İndi də Məkkə ilə Taif arasında gedib-gələnlərin daş atması ilə daşlıq təpəyə çevrilən o qəbir Əbu Riğalın qəbridir. Əbrəhə oradan yola düşüb, Əsvəd ibn Məsud adlı bir kişini ordunun öncü hissəsinə əmir təyin edib, Məkkə əhlinin heyvanlarını əllərindən alıb, qəsb etməyi əmr etdi. Əsvəd Məkkə əhlinin heyvanlarını əllərindən aldı. O cümlədən peyğəmbərin babası Əbdülmüttəlibin 200 dəvəsini əlindən aldı. Əbrəhə gedib, Hərəmdən kənarda qoşunuyla dayandı. Məkkənin dörd bir tərəfindən bir neçə mil kənarda müxtəlif əlamətlər vardır. O əlamətlərdən Məkkəyə qədər olan bölgəyə Hərəm deyilir. Oradan Əbrəhə Hünata adlı bir kişini Məkkə əhlinə göndərib dedi: "Gedib Məkkə əhlinin rəisini tap, mənim tərəfimdən ona de ki, - mən

sizinlə savaşmağa gəlməmişəm. Ancaq Kəbəni dağıtmaq üçün gəlmişəm. Hünata Məkkəyə gedib, Məkkə əhlinin rəisi olan Əbdülmüttəlib Haşim oğlunu görüb, Əbrəhənin sözünü ona çatdırdı. Əbdülmüttəlib dedi: "Bizim Əbrəhə ilə davamız yoxdur və ona qarşı dura bilmərik. Biz onunla Kəbənin arasını boşaldarıq. Bu ev Allah-Təalanın evidir, onun peyğəmbəri İbrahimin tikdiyi evdir. Əgər bu evi xarab etmək üçün gəlibsə, Allah-Təala öz evini qoruyar, yoxsa bizim Əbrəhə ilə savaşıb, onu qovmağa gücümüz çatmaz. Ondan sonra Əbdülmüttəlib dəvələrindən ötrü Əbrəhənin yanına getdi. Xəbər verdilər ki, Məkkənin rəisi sənin yanına gəlir, izin verdi. Əbdülmüttəlib uca boylu, gözəl surətli bir şəxs idi. Elə ki, Əbrəhənin hüzuruna daxil oldu, Əbrəhə ona hörmət etdi. Əbdülmüttəliblə birlikdə yerdə əyləşdi. Ondan sonra soruşub dedi: "Niyə gəlibsən? Nə istəyirsən de. Zənn edirdi ki, Kəbəni qorumaq üçün xahiş etməyə gəlibdir. Əbdülmüttəlib dedi: "Padşahdan istəyim budur ki, mənim 200 dəvəmi qəsb ediblər, onları mənə qaytarsınlar. Əbrəhə dedi: "Mən səni görəndə gözümdə böyütmüşdüm, amma indi gözümdən düşdün. Əbdülmüttəlib dedi: "Niyə? Əbrəhə dedi: "Mən gəlmişəm sənin dininin binası olan Kəbəni dağıdıb, xarab edim. Sən ondan ötrü xahiş etməyib, dəvələrini istəyirsən. Əbdülmüttəlib dedi: "Mən dəvələrin sahibiyəm, Kəbənin öz sahibi vardır, sənə mane olub, özü qoruyar. Əbrəhə dedi: "Mane ola bilməz. Əbdülmüttəlib dedi: öz işinlə məşğul ol. Əbrəhə əmr edib, Əbdülmüttəlibin dəvələrini qaytardılar. Əbdülmüttəlib dəvələrini götürüb gedib, Qüreyş camaatına xəbər verib, onlara Məkkə dağlarındakı təpələrə sığınmağı əmr etdi. Qüreyş camaatı Məkkəni boşaldıb, dağlardakı təpələrə sığındılar. Əbdülmüttəlib gedib Kəbə qapısının halqasından yapışıb bu şeirləri dedi:

- "Ey Allahım, qul ailəsini qoruyar, sən də hilalını, evini qoru!

Onların xaçı və qüvvəti sabah sənin qüvvətinə əsla üstün gələ bilməz.

Əgər sən onları bizim qibləmizə-Kəbəmizə buraxsan, bu sənin biləcəyin işdir.

(Onun hikmətini ancaq sən bilirsən).

Bölgələrdən quldurları gətirdilər. Bir də fil, sənin evini qarət etmək üçün.

Cahilcəsinə sənə tələ qurub, evinə qəsd etdilər, böyüklüyünü nəzərə almadılar. Əgər sən onları bizim qibləmizə-Kəbəmizə buraxsan, bu sənin biləcəyin işdir".

Yenə dedi ki,

- "Ey mənim rəbbim! Səndən başqasına sığınacaq deyiləm. Ey mənim rəbbim, onları öz evindən dəf et!"

Ondan sonra Əbdülmüttəlib Kəbənin halqasını buraxıb, Qüreyş camaa-

اَلَمْ تَرَ كَيْفَ فَعَلَ رَبُّكَ بِاَصْحَابِ الْفِيلِۜ ﴿١﴾ اَلَمْ يَجْعَلْ كَيْدَهُمْ فٖي تَضْلٖيلٍۙ ﴿٢﴾ وَاَرْسَلَ عَلَيْهِمْ
طَيْرًا اَبَابٖيلَۙ ﴿٣﴾ تَرْم۪يهِمْ بِحِجَارَةٍ مِنْ سِجّٖيلٍۙ ﴿٤﴾ فَجَعَلَهُمْ كَعَصْفٍ مَأْكُولٍ ﴿٥﴾

---

tıyla birlikdə Hira dağına qalxıb, Məkkəni boşaltdılar. Əbrəhə Müğəmmis adlı yerdən qalxıb Məkkəyə daxil olmağa niyyət etdi. Fillər qoşunun qabağında, hamısından qabaqda Mahmud elə ki, gəlib Hərəmə çatdılar, Mahmud dayandı. Fil baxıcısı gəlib başına vursa da, qalxmadı. Ayağa qaldırıb, Yəmən tərəfinə yönəltdilər, sürətlə getməyə başladı. Yenidən qaytarıb, Hərəmə çatanda dayanıb getmirdi. Əbdülmüttəlib Qüreyş camaatıyla dağdan baxırdılar. Gördülər Yəmən tərəfindən çoxlu quşlar peyda oldu. Quşlar Əbrəhənin qoşununa çatıb, hər birinin dimdiyində noxuddan kiçik, bir dənə qurumuş palçıqdan daş kimi bir şey qoşunun üstünə tökdülər. Kimə dəyirdi, yandırıb həlak edirdi. Qaçmağa başladılar. Çöldə, dağlarda, dərələrdə həlak oldular. Əbrəhənin özü cüzam kimi bir dəri xəstəliyinə tutulub, Sənaya çatan kimi həlak oldu. Necə ki, Allah-Təala surədə xəbər verir. İkrimə deyir: "O daşlar kimə ki, dəyirdi, çiçək çıxarıb həlak olurdu. Ola bilər ki, Allah-Təala o camaatı çiçək xəstəliyinə düçar etdi. Ola bilər ki, çiçək xəstəliyinin səbəbi Allah-Təalanın batini qoşunu olan quşların onlara daş atıb, bədənlərini dəlik-deşik etməsi idi. Allahın Rəsulu (ə.s) həmin il anadan oldu. Doğrusunu Allah bilir. Bundan sonra surənin təfsiri başlayır.

**1)** (اَلَمْ تَرَ كَيْفَ فَعَلَ رَبُّكَ بِاَصْحَابِ الْفِيلِۜ) - (Ey Məhəmməd), **bəs baxıb agah olmursan ki, sənin rəbbin Allah-Təala fil** (Əbrəhənin) **əshabına və qoşununa əzab göndərib, onları necə həlak etdi? Əlbəttə, sən xəbərdar olduğun kimi bu** (Qüreyş) **camaatı da agah olubdur. Bəs niyə iman etməyib, haqqı inkar edirlər?**

**2)** (اَلَمْ يَجْعَلْ كَيْدَهُمْ فٖي تَضْلٖيلٍۙ) **- Bəs** (Əbrəhənin) **özünün, qoşununun** (Kəbəni) **dağıtmaq barəsindəki hiylələrini məhv və batil etmədimi?**

**3-4)** ( وَاَرْسَلَ عَلَيْهِمْ طَيْرًا اَبَابٖيلَۙ تَرْم۪يهِمْ بِحِجَارَةٍ مِنْ سِجّٖيلٍ ) **Allah-Təala onlara Əbabil adlı elə quşlar göndərdi ki, bişmiş palçıqdan** (bişmiş kərpic kimi) **olan daşları onları atırdılar.**

**5)** (فَجَعَلَهُمْ كَعَصْفٍ مَأْكُولٍ) **- Daş atmaqla onları həlak edib, heyvanların yeyib, ayaqladığı ot* kimi etdi.** (Necə ki, otluğun içinə heyvanı buraxanda onun bir qismini yeyib, digər qismini tapdalayıb əzər, Allah da əzəli iradəsi ilə o qoşunu elə əzdi).

**(*Qeyd:** *"Allah-Təalanın əzəli iradəsi bəzən Kəbəni dağıtmağa gələn Əbrəhənin özünü və qoşununu həlak etmək yönündə olur, bəzən də Kəbəni dağıtmaq istəyən zalımlara mane olmur, Kəbəni xarab, "həcərül-əsvəd"i (qara daşı) parça-parça edib, qəbilələrin arasında paylaşdırırlar. Bir dəfə islamdan əvvəl*

*Qüzaə (Xüzaə) qəbiləsi Qüreyş camaatı ilə savaşıb, onlara qalib gəldilər. Kəbəni xarab edib, "qara daş"ı parça-parça edib, qəbilələrə payladılar. Aralarında sülh olandan sonra o daş parçalarını yenidən bir yerə toplayıb, öz yerinə qoydular. (Necə ki, indi Kəbənin sütununda müşahidə olunur). İkinci dəfə - Məkkədə Abdullah ibn Zübeyr xəlifəliyini elan edib, Hicaz əhli ona beyət edəndən sonra Dəməşqdən Əməvi xəlifəsi Əbdülməlik ibn Mərvan İraq hakimi Həccac ibn Yusifə Abdullah ibn Zübeyrlə savaşmağı əmr etdi. Axırda Abdullah ibn Zübeyr müqavimət edə bilməyib, Kəbəyə sığındı. Həccac ibn Yusifin əmri ilə mancanaq vasitəsi ilə Kəbəni dağıdıb, Abdullah ibn Zübeyri oradan çıxarıb, öldürdülər. Üçüncü dəfə - Misirdə Fatimi xəlifələri zamanında ortaya çıxan qərmətilər Kəbəyə hücum edib, Kəbəni dağıtdılar. Sonra yenidən xəlifənin əmri ilə Qərmətilər Kəbəni bərpa etdilər. Dördüncü dəfə Osmanlı sultanı Əbdüləziz zamanında zühur edən vəhhabilər Kəbəni dağıdıb, Mədinədə, peyğəmbər məscidinə at bağladılar. Misirdə, Qahirədə nüfuz sahibi olan Məhəmməd Əli Paşa sultanın əmri ilə əvvəlcə oğlu Tosun Paşa, ondan sonra özü gedib, vəhhabiləri dağıdıb, Kəbəni bərpa etdi. İndiki Kəbə həmin mərhum Məhəmməd Əli Paşanın bərpa etdiyi binadır. Allah ondan razı olsun. Bu hadisələrdə Allah-Təala Kəbənin dağıdılmasına mane olmamışdır. Hikmətini sadəcə Allah bilir. Ola bilər ki, bu surədə "fil əhli"ndən məqsəd Kəbəni dağıtmaq istəyən başqa bir tayfadır, lakin o barədə tarixçilər bir şey deməyibdir. Amma həmin tarixi dövr ərəblər arasında "Fil ili" kimi məşhur olduğuna görə, surənin Əbrəhə əhvalatı ilə əlaqəli olduğuna inanmaq lazımdır. Allah yardım edəndir).*

Allaha həmd olsun, Fil surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim Fil surəsini oxusa, Allah-Təala onu zəlzələ səbəbi ilə yerə batmaqdan mühafizə edər."*

## QÜREYŞ SURƏSİ

106-cı surədir. Məkkədə nazil olub, 4 ayə, 17 kəlmə və 73 hərfdir.

لِاِيلَافِ قُرَيْشٍۙ ﴿١﴾ اِيلَافِهِمْ رِحْلَةَ الشِّتَٓاءِ وَالصَّيْفِۚ ﴿٢﴾ فَلْيَعْبُدُوا رَبَّ هٰذَا الْبَيْتِۙ ﴿٣﴾ اَلَّذ۪ٓي اَطْعَمَهُمْ مِنْ جُوعٍ وَاٰمَنَهُمْ مِنْ خَوْفٍ ﴿٤﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1-2)** (لِاِيلَافِ قُرَيْشٍۙ اِيلَافِهِمْ رِحْلَةَ الشِّتَٓاءِ وَالصَّيْفِۚ) - (Ey Məhəmməd), **Allah-Təala bu Qüreyş camaatının arasına ülfət və dostluq salıb, onları hər bir qorxudan əmin etdi ki, ticarətlə məşğul olub, ildə iki dəfə - qışda** (Yəmənə), **yayda** (Şama) **ticarətə gedirlər.**

**3-4)** (فَلْيَعْبُدُوا رَبَّ هٰذَا الْبَيْتِۙ اَلَّذ۪ٓي اَطْعَمَهُمْ مِنْ جُوعٍ وَاٰمَنَهُمْ مِنْ خَوْفٍ) **- Bu Qüreyş camaatı hər hansı bir neməťdən ötrü Allah-Təalaya ibadət və qulluq etməsələr də, hər halda elə ülfət tapıb, əmin-amanlıq içində ticarət etdikləri üçün, onları aclıqdan qurtarıb yemək verdiyi üçün və qorxudan əmin etdiyi üçün gərək bu Kəbənin rəbbi Allah-Təalaya ibadət etsinlər, nəinki həqiqi məbud olan Allah-Təalanı unudub, heç vaxt yaddan çıxartmasınlar.**

(Kəbəni cənab İbrahim oğlu İsmayılın yardımı ilə tikdi. Oğlu İsmayılı anası Həcərlə birlikdə orada məskun edib, insanları Kəbənin ziyarətinə dəvət etdi. Cənab İsmayıl ərəb tayfası olan Bəni-Cürhüm camaatından qız alıb, çoxlu övladı oldu. İsmayılın nəsli artıb, övladlarından qəbilələr və tayfalar yarandı. Hamısından məşhuru Qüreyş tayfası idi. İsmayılın oğullarından Nəzr ibn Kinanənin nəslinə Qüreyş deyilir. Qüreyş tayfası da bir neçə qəbiləyə bölündü. Ən məşhuru iki qəbilə oldu: "Bəni-Haşim və Bəni-Ümeyyə. Cahiliyyə zamanında Bəni-Ümeyyə Bəni Haşimdən sayca çox olduqlarından savaşlarda daha məşhur idilər. Lakin Bəni-Haşim Ərəbistan yarımadasında məskun olan ərəblər arasında Bəni-Ümeyyədən daha möhtərəm və əziz idi. Peyğəmbərin babaları və əcdadı Qüreyş tayfasına hakim olub, məşhur şəxslər idilər. Qüreyş tayfası qol-budaq atıb, Bəni-Haşim qəbiləsi zühur edərkən, Abdullah ibn Əbdülmüttəlib ibn Hişamla Əminə Vəhəb qızından aləmlərin nuru olan Məhəmməd (ə.s) dünyaya gəldi. İsmayıl nəslinin arasında bütpərəstlik meydana gəlib, peyğəmbərin zühuruna yaxın daha da qüvvətləndi. O cənabın səyi və lütfü sayəsində şirk və küfr aləmi məhv olub, qiyamətə qədər var olacaq olan islam dini meydana gəldi. Məkkədə məskun olan İsmayıl nəslinin işi ən gözəl peşə olan ticarətlə məşğul olmaq idi. İldə iki dəfə - qış fəslində

Yəmənə, yay fəslində Şama ticarətə gedirdilər. Hz. Məhəmməd də ticarətlə məşğul olub, Xədicənin sərmayəsi ilə iki dəfə Şama ticarətə getmişdi. Qüreyş camaatından ticarətlə məşğul olub, qışda Yəmənə, yayda Şama gedən ilk şəxs Haşim ibn Əbdi-Mənaf olmuşdu. Ticarət sənətini Qüreyş camaatına öyrədib, onlara yadigar qoydu. Necə ki, şair Əbdi-Mənaf övladlarını mədh edib, ticarət sənətini Haşimin onlardan ötrü yadigar qoymasını bəyan edir:

"Ey yükünü, səfərlərini dəyişdirən adam!

Kaş Əbdi-Mənaf ailəsinə getsəydin...

Onlar üfüqlərindən əhd almışlar,

Və səfərə getmək üçün səfər edərlər.

Bir bəxşiş verən tapılmazkən onlar bəxşiş verərlər.

Və müsafirlərə - buyurun, deyərlər.

Və zənginlərini yoxsullarına qarışdırarlar.

Hətta yoxsulları özlərinə kafi bir həyay sürər.

Ömər qövmünə qızardılmış çörək yedirirdi, Məkkə xalqı  isə ac idi".

Haşimin adı Ömər idi. İnsanlara çörək yedirdiyi üçün ona Haşim deyildi. Necə ki, şairin şeirində bu mətləbə işarə olunubdur. Qüreyşdə ticarət sənəti Hişamın qoyduğu qayda üzrə gedirdi. Allah-Təala Qüreyş camaatının əmin-amanlıq içində ticarətlə məşğul olmalarını onlara böyük minnət sayıb, o səbəbdən surədə onlara ibadət etməyi əmr edir. Yəni nemətin qarşılığında gərək şükür edilsin. Şükrün ilk dərəcəsi Allah-Təalaya ibadət etməkdir. Gərək bəndə Allah-Təalaya ibadət etsin ki, bəndəlik əlaməti zahir olsun.

Allaha həmd olsun, Qüreyş surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim Qüreyş surəsini oxusa, Allah-Təala ona on savab bəxş edər)."*

## əl-MAUN SURƏSİ

107-ci surədir. Məkkədə nazil olub, 7 ayə, 25 kəlmə və 125 hərfdir.

اَرَاَيْتَ الَّذ۪ي يُكَذِّبُ بِالدّ۪ينِۜ ﴿١﴾ فَذٰلِكَ الَّذ۪ي يَدُعُّ الْيَت۪يمَۙ ﴿٢﴾ وَلَا يَحُضُّ عَلٰى طَعَامِ الْمِسْك۪ينِۜ
﴿٣﴾ فَوَيْلٌ لِلْمُصَلّ۪ينَۙ ﴿٤﴾ اَلَّذ۪ينَ هُمْ عَنْ صَلَاتِهِمْ سَاهُونَۙ ﴿٥﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1)** (اَرَاَيْتَ الَّذ۪ي يُكَذِّبُ بِالدّ۪ينِۜ) - (Ey Məhəmməd), **cəza və haqq-hesab gününü təkzib edib, inkar edəni görüb tanıyırsanmı? Əgər tanımırsansa, mən onun əlamətlərini deyirəm ki, kimdə o əlamətləri görsən, biləsən ki, o, qiyamət gününü inkar edəndir. Onun əlamətləri budur:**

**2)** (فَذٰلِكَ الَّذ۪ي يَدُعُّ الْيَت۪يمَۙ) **- Birincisi - o şəxs yetim* görəndə yetimi şiddətlə itələyər, əziyyət edib, qəzəblə və sərtliklə onu qovub, haqqını verməz.**

**(*Qeyd:** *Surədə yetim və yoxsullar nümunə üçün qeyd olunubdur. Bəlkə də əsl məqsəd Qurani-Şərifdə peyğəmbərin möcüzəli bəyanı ilə əmr olunan gözəl sifətləri tərk etməyin cəza gününü, qiyaməti inkar və təkzib etmək əlaməti olmasıdır. Ey islam ümməti, bu açıq-aydın ayələrə fikir verin, özünüzə Quran əhli deyirsiniz, halbuki Quranın ehkamına əməl etməmək, onu inkar etmək deməkdir. Bizim aramızda Quranın ehkamı haradadır? Quranın digər ehkamları bir yana qalsın, bu surədə qeyd olunan ehkama əməl olunurmu? Nə vaxt yetim və yoxsul müsəlmanların dərdini çəkib, onların əhvalına həmdərd olunub? Onların dərdini çəkmək bir dirhəm, ya bir tikə çörək, ya da ki, bir libas vermək deyildir. Çünki belə olanda bəzilərinin halı məlum olmayıb, gizli qalır, əksinə bütün yetim və yoxsulların halını gərək soruşub, onlardan ötrü məktəblər açıb, elm öyrətmək lazımdır. Elmə qabil olmayan yetim və yoxsullar üçün sığınacaq evləri açıb, illik xərclərinə kəfil olmaq lazımdır. Belə xeyir əməllər biz müsəlmanlardan meydana gəlirmi? Hərçənd keçmiş zamanlarda olubdur, lakin indi bunlar yox kimidir. Millətin xoşbəxtliyi belə işlərə yönəlib, xeyriyyəçiliklə, savab işlərlə məşğul olmaqdadır. Nəinki pul sandıqlarına söykənib, yetim və yoxsullar bir şey istəyəndə də bir quruş verməyib, hətta acı söz deyib dəf edəsən. Ayənin hökmü ilə belə şəxslərə nicat yoxdur).*

**3)** (وَلَا يَحُضُّ عَلٰى طَعَامِ الْمِسْك۪ينِۜ) (İkincisi) **Ailəsinə, qohum-əqrəbasına və ona tabe olub itaət edənlərə yoxsulların əhvalını soruşub, yemək verməyi əmr edib, təşviq etməz.**

**5)** (فَوَيْلٌ لِلْمُصَلّ۪ينَۙ اَلَّذ۪ينَ هُمْ عَنْ صَلَاتِهِمْ سَاهُونَ) **Yetimləri qovub, yoxsullara**

اَلَّذٖينَ هُمْ يُرَآ ؤُنَۙ ﴿٦﴾ وَيَمْنَعُونَ الْمَاعُونَ ﴿٧﴾

---

**yardım etməyə təşviq etməyənlər əzaba layiq olduğu kimi, namazlarında* tənbəllik və qafillik edənlərə də əzab olsun. Hansı ki, səhlənkarlıq edib, namazı vaxtından tez, ya da gec qılarlar. Ya da ki, namazda təvazökarlıq etməyib, sanki daha əhəmiyyətli işləri varmış kimi, tez qılıb qurtararlar. Bilməzlər ki, nə deyirlər və kimin hüzurunda durub, kimə ibadət edirlər.** (Allah-Təala belə namaz qılanlara və bundan sonra qeyd olunan əməllərin sahiblərinə əzab vədi verir).

**(*Qeyd:** *Ayə namazda tənbəllik edənlər, gah qılıb, gah qılmayanlar haqqında nazil olubdur. Lakin namazın sayında, namazın içində səhv edənlər ayənin xaricindədirlər. Ayə onlara şamil deyil. Bəzi avamlar, Qurani-Şərifə agah olmayanlar cahilliklərindən ayəni namazda səhv, ya da şəkk edənlərə isnad edib, onlara irad tuturlar. Bunlar cəhalətdən meydana gələn sözlərdir. Əgər ayə sadəcə namazdakı səhvlərə işarə etsəydi, gərək "an salatihim sahun" (namazlarından qafildirlər) əvəzinə "fi salatihim sahun" (namazın içində qafildirlər) nazil olaydı, İnsanlıq şəkk və səhvdən xali olmadığı üçün bu əmr "insanın daşıya bilməyəcəyi bir yük" olardı. Hətta təfsirçilərdən Zəməxşəri, Nəsəfi namazda səhv və şəkk etməyi peyğəmbərə də isnad etmişlər, hansı ki, o, hər bir nöqsan və eyibdən pak və ucadır).*

**6) (اَلَّذٖينَ هُمْ يُرَآ ؤُنَۙ وَيَمْنَعُونَ الْمَاعُونَ) Namazda səhlənkarlıq edənlərin sifətlərindən biri də odur ki, hər bir xeyir əməldə riya edib, zəkat verməyib, qonşuya lazım olan bəzi şeyləri də** (məsələn, balta, qazan, boşqab və s. əşyanı) **müvəqqəti istifadə etməsi üçün verməyə mane olar. Belə şəxslərə əzab olsun.**

Allaha həmd olsun, əl-Maun surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim əl-Maun surəsini oxusa, əgər zəkat verən şəxs olsa Allah-Təala onu bağışlayar".*

## əl-KÖVSƏR SURƏSİ

108-ci surədir. Məkkədə nazil olub, 4 ayə, 10 kəlmə və 42 hərfdir.

اِنَّٓا اَعْطَيْنَاكَ الْكَوْثَرَ ﴿١﴾ فَصَلِّ لِرَبِّكَ وَانْحَرْ ﴿٢﴾ اِنَّ شَانِئَكَ هُوَ الْاَبْتَرُ ﴿٣﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (اِنَّٓا اَعْطَيْنَاكَ الْكَوْثَرَ)** - (Ey Məhəmməd), **həqiqətən, biz sənə dünya və axirətdə bol xeyir* bəxş etdik. Dünyada peyğəmbərlik dərəcəsini, müşrik və inkarçılara qalib olmağı, islamı dünyada yaymağı, axirətdə də şəfaət məqamını sənə bəxş etdik.** (Peyğəmbər ə.s. Məkkədə olan vaxtı bu ayənin nazil olması islamın yayılmasını o cənaba əvvəlcədən müjdə verməkdən ötrüdür).

**(*Qeyd:** *"Kövsər sözü ərəbcədə çoxluq mənasındadır. Bəzi hədislərə əsasən təfsirçilər surədəki kövsər sözünü axirətdəki bir çaya isnad ediblər, hansı ki, onun suyu baldan şirin, süddən ağ, qardan soyuq olur (Müslüm Təharət, 46). İbn Abbas kövsər sözünə bol nemət mənası verib. Səid ibn Cübeyr ona sual verib dedi: "Bəzilərinə görə kövsər cənnətdə bir çaydır. İbn Abbas buyurdu: "Cənnətdə olan çay da bol nemətdən sayılır. Nə gözəl cavabdır, qızılla yazılmağa layiqdir. Doğrudur, Allah-Təala peyğəmbərə o çaydan xeyli şirin nemətlər bəxş edəcəkdir, lakin ayəni çaya isnad etməklə peyğəmbərə və islama nə fayda gəlir, halbuki ayənin əsl qayəsi bol nemət mənası ilə anlaşılır. Gərək ərəblərin istifadə etdiyi mənaya tabe olaq, bir şair kövsər sözünə şeirində bol nemət mənası verib, belə deyir:*

*-"Ey İbn Mərvan, sən sayca çox və əxlaqca gözəl birisən,*
*Atan ibn Əqail isə kövsər (dostu, malı, hər şeyi çox olan) biri idi".*

*İbn Abbas deyən kimi – Qurani-Şərifdə hansı kəlmənin mənası sizə müşkül olsa, ərəb şairlərinin şeirini axtarıb, o sözün mənasını tapıb, elə məna verin. Gərək ərəblərin verdiyi mənaya tabe olaq. Kövsərə bol nemət mənası verəndə hədis də öz məqamında qalıb, İbn Abbas deyən kimi bol nemətin əhatə dairəsinə daxil olur. Ayə və hədisə də heç bir xələl gəlməz. Amma təkcə hədisdəki mənanı verəndə, ayənin ecazkar mənası itib, islamın və peyğəmbərin doğruluğuna dəlil ola bilməz. Diqqət etmək lazımdır).*

**2) (فَصَلِّ لِرَبِّكَ وَانْحَرْ)** - (Ey Məhəmməd), **bu bol nemətə şükür etmək üçün sənə şərəf və əzəmət bəxş edən rəbbin Allah-Təalaya ibadət edib, dəvəni qurban edən kimi** (xəbis nəfsini də) **qurban edib, başını kəsib, nəfsin istəklərindən vaz keçib, Allah-Təalanın əmr və qadağalarına itaət et.**

**3) (اِنَّ شَانِئَكَ هُوَ الْاَبْتَرُ)** (Həqiqətən, Ey Məhəmməd), **səni düşmən sayıb, sənə**

**müxalif olanların adları öləndən sonra itib, yaddan çıxacaq, nəinki sənin adın. Əksinə sənin adın ucalıb, minbərlərdə, məscidlərdə və minarələrdə bütün insanların dilində əbədi olaraq zikr olunacaqdır.** (Allah-Təala vədinə vəfa edib, yer kürəsində məskun olan müxtəlif millətlərin arasında onun uca adını yayıb, hər bir dildə və hər bir kitabda qeyd olunur. Bu da o cənabın haqlılığına böyük dəlil və sübutdur).

Allaha həmd olsun, Kövsər surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim Kövsər surəsini oxusa, Allah-Təala cənnət çaylarından ona içizdirər."*

## əl-KAFİRUN SURƏSİ

109-cu surədir. Məkkədə nazil olub, 7 ayə, 26 kəlmə və 94 hərfdir.

قُلْ يَآ اَيُّهَا الْكَافِرُونَۙ ﴿١﴾ لَآ اَعْبُدُ مَا تَعْبُدُونَۙ ﴿٢﴾ وَلَا اَنْتُمْ عَابِدُونَ مَآ اَعْبُدُۚ ﴿٣﴾ وَلَآ اَنَا۬ عَابِدٌ مَا عَبَدْتُمْۙ ﴿٤﴾ وَلَآ اَنْتُمْ عَابِدُونَ مَآ اَعْبُدُۜ ﴿٥﴾ لَكُمْ دِينُكُمْ وَلِيَ دِينِ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

Məkkədə Qüreyş camaatının islama daxil olması ümidi kəsilmişdi. Peyğəmbərə dedilər: “Ey Məhəmməd, sən bizim dinimizə tabe ol, biz də sənin dininə tabe olaq. Bir il sən bizim məbudlarımıza ibadət et, bir il də biz təkcə sənin məbuduna ibadət edək. O cənab buyurdu: “Allah məni ona şərik qoşmaqdan qorusun, bu, mümkün olan şey deyil. Dedilər: “Heç olmasa, bizim bütlərin bəzisinə əlinə sürtüb, üzünə çək. Allahın Rəsulu cavab verməyib evinə getdi. O vaxt bu surə nazil oldu. Ertəsi gün o cənab Məscidül-harama gedib, həmin camaat orada ikən, onların başının üstündə durub, bu surəni başdan axıra kimi onlara oxudu. O zaman Qüreyş camaatı peyğəmbəri öz dinlərinə qaytarmaqdan birdəfəlik ümidlərini kəsib, ona və səhabələrinə əziyyət etməyə başladılar. Bundan sonra surənin təfsiri başlayır.

**1-2)(قُلْ يَآ اَيُّهَا الْكَافِرُونَۙ لَآ اَعْبُدُ مَا تَعْبُدُونَۙ)** - (Ey Məhəmməd), **bu kafirlər ki, onların bütlərinə sənin ibadət etməyini arzu edirlər, onlara de: “Ey haqqı inkar edib, üstünə pərdə çəkib, iman etməyənlər, sizin ibadət etdiyiniz bütlərə mən əsla ibadət edən deyiləm. Məndən ümidinizi kəsin.**

**3) (وَلَا اَنْتُمْ عَابِدُونَ مَآ اَعْبُدُۚ) Və sizin hərəkətlərinizdən belə məlum olur ki, bundan sonra mənə tabe olub, mənim ibadət etdiyim mütləq qüdrət sahibi, yeganə Allah-Təalaya ibadət etməyəcəksiniz.**

**4) (وَلَآ اَنَا۬ عَابِدٌ مَا عَبَدْتُمْ) Və keçmişdə, mən peyğəmbər olmazdan əvvəl da sizin ibadət etdiyiniz bütlərə heç vaxt ibadət etməmişəm.** (Cahiliyyə dövründə belə iş görməmişəmsə, islamdan sonra mənim müşrik olmama necə ümid edirsiniz?)

**5) (وَلَآ اَنْتُمْ عَابِدُونَ مَآ اَعْبُدُۜ) Və keçmişdə, nə də indi elə bir vaxt olmayıb ki, sadəcə mənim ibadət etdiyim yeganə Allah-Təalaya ibadət edib. ona şərik qoşmayasınız. Həmişə müşrik olub, ona şərik qoşmusunuz.**

**6) (لَكُمْ دِينُكُمْ وَلِيَ دِينِ) - Mən sizi haqq və nicat tərəfinə dəvət etməyə gəlmişəm. İndi ki, mənə tabe olmursunuz, daha məndən əl çəkib, məni**

**şirk tərəfinə dəvət etməyin. Sizin dininiz** (şirkiniz) **sizə, mənim dinim** (tövhidim) **mənə olsun. Ta ki, Allah-Təala öz kamil qüdrəti ilə bizim aramızda hökm etsin.** (Allahın Rəsulu Allahın əmri ilə müşriklərlə belə danışıb, onlardan üz döndərdi. Dəvətində möhkəm olub, onların hər bir əziyyətinə müqavimət etdi. Həm özü, həm də səhabələri onların qabağında sədd kimi durub, islamı yaymaq üçün əziz həyatlarından əl çəkib, gecə-gündüz hər yerdə "la ilahə illallah" deyib, bir an da qəflət etmədilər. Ta ki, Allah-Təala onların səyini zay etməyib, islamı dünyaya yayıb, onları mükafatlandırdı. Ey Allahın Rəsulu! Allah sənə də, səhabələrinə də mükafat versin. Allahın salamı sənə, ailənə və əshabına olsun!)

Allaha həmd olsun, əl-Kafirun surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim əl-Kafirun surəsini oxusa, Quranın dörddə birini oxumuş kimi olar, şeytanlar da ondan uzaq olub, şirkdən qorunar. Qiyamət gününün qorxusundan da arxayın olar."*

## ən-NƏSR SURƏSİ

110-cu surədir. Mədinədə nazil olub, 4 ayə, 17 kəlmə və 77 hərfdir.

**Bismillahir-Rəhmanir-Rəhim**

**Məkkənin fəthinin müxtəsər nəqli.**

**Hicrətin 8-ci ilində, Ramazanın ilk günündə Allahın Rəsulu Məkkəni fəth edib, Kəbəni bütlərdən təmizlədi. Məkkənin fəthi qissəsində ağıl sahiblərindən ötrü ibrət və peyğəmbərin doğruluğuna və haqlı olmasına böyük dəlil və sübutlar vardır. Gərək diqqət edilsin. Məkkənin fəthinin qissəsi belədir: Elə ki, peyğəmbər (ə.s) hicrətin 7-ci ilində Qüreyş camaatı ilə sülh edib Bəni-Bəkir camaatı Qüreyşlə, Xüzaə camaatı da peyğəmbərlə müttəfiq oldular, peyğəmbər də Mədinəyə qayıtdı. Hüdeybiyə sülhünün qissəsi Fəth surəsində keçdi. Oraya baxılsın. Bir müddət sonra Xüzaə camaatı Məkkənin aşağı tərəfində özlərinə məxsus Vətir adlı su quyusunun yanında məskun olmuşdular. Bəni-Bəkirdən Novfəl ibn Müaviyə adlı bir kişi gizlicə gedib, Xüzaə camaatından birinin qanını tökdüyündən iki tayfa arasında savaş başladı. Mədinə Məkkədən uzaq olduğundan Xüzaə camaatı peyğəmbərdən yardım ala bilmədilər, lakin Qüreyş camaatı Bəni-Bəkir camaatına silah verib, özləri də gecə vaxtı savaşmağa getdilər. Savaşa gedən Qüreyşin əyanlarından Süfyan ibn Ümeyyə, İkrimə ibn Əbu Cəhl, Süheyl ibn Əmr və onların qulamları Xüzaə camaatına qalib gəldilər. Xüzaə camaatı məcbur qalıb, Hərəmə sığındılar ki, bəlkə Bəni-Bəkir camaatı davadan vaz keçsin. Lakin vaz keçmədilər. Xüzaə səsləndi: “Ey Novfəl, sənin rəbbin Allah-Təalanın hərəminə daxil olmuşuq, bizdən əl çəkin. Novfəl dedi: “Bu gün Novfəlin Allahı yoxdur. Və Bəni-Bəkri savaşı davam etdirməyə çağırdı. Xüzaə camaatından öldürdüklərini öldürüb, mallarını qarət etdilər, qalanları da qaçdı. Xüzaə camaatı peyğəmbərin müttəfiqi olduğundan, Qüreyş və Bəni-Bəkir camaatı peyğəmbər ilə bağladıqları müqaviləni pozub, Xüzaə camaatının qanını tökdülər. Xüzaə də onlar kimi müşrik idi. Lakin içlərindən bəziləri müsəlman olmuşdular. Amma Hüdeybiyyə sülhündə müşrik və müsəlman bütün Xüzaə camaatı peyğəmbərlə müttəfiq oldular. Xüzaə camaatından Əmr ibn Salim adlı kişi qaçıb Mədinəyə getdi. Peyğəmbər (ə.s) məsciddə camaatın içində oturarkən Əmr ibn Salim gedib Qüreyşlə Bəni-Bəkrin müqavilәni pozduqlarını və onları öldürüb, mallarının qarət etdiklərini peyğəmbərə danışıb, bu şeiri oxudu:**

**- "Allahım, Məhəmmədə səslənirəm:**

**Atamızın və nəcib atasının əhdinə tabe ol, deyə!**

**Allahım, Rəsuluna yardım et. Qullarını da çağır, yardım etsinlər.**

**Aralarında Allahın Rəsulu var. Ayın on dördü kimi parlaq və uca.**

**Qüreyş sənə verdiyi sözündə durmadı. Etdikləri andı pozdu.**

**Kimsəni yardıma çağırmayacağımı zənn edərək, Kədada mənə tələ qurdular.**

**Halbuki onlar həm daha zəlil, həm də azdırlar.**

**Vətirdə gecə ikən bizə hücum etdilər, rüku və səcdədə ikən öldürdülər.**

**Bizə yardım et, Allah da sənə əbədiyyən yardım etsin".**

**Allahın Rəsulu (ə.s) buyurdu: "Ey Əmr ibn Salim, əlbəttə sənə kömək ediləcək. Onun arxasınca Büdeyl ibn Vərqa Xüzaə camaatından bir neçə nəfərlə Mədinəyə peyğəmbərin hüzuruna gəlib, Bəni-Bəkrin müqaviləni pozduğunu, onlara hücum edib, bir çoxunu öldürdüyünü və Qüreyşin də onlara yardım etdiyini bəyan edib, qayıdıb getdilər. Peyğəmbər buyurdu: "Belə görürəm ki, Əbu Süfyan müqavilənin müddətini uzadıb möhkəmlətmək üçün gələcəkdir. Büdeyl ibn Vərqa yoldaşlarıyla Mədinədən geri qayıdanda, Əffan adlı yerdə Əbu Süfyanla qarşılaşdılar. Qüreyş camaatı öz əməllərindən qorxub, müqaviləni möhkəmlətməkdən ötrü (guya peyğəmbər onların Xüzaə ilə savaşmalarından bixəbərdir) onu peyğəmbərin yanına göndərmişdilər. Əbu Süfyan Büdeylin peyğəmbərin yanından gəldiyini düşünüb, dedi: "Haradan gəlirsən? Büdeyl dedi: "Dəniz kənarından gəlirəm. Əbu Süfyan dedi: "Məhəmmədin yanına getmişdin? Büdeyl dedi: xeyir, getməmişəm. Büdeyl gedəndən sonra Əbu Süfyan dedi: "Əgər bu Mədinəyə gedibsə, hər halda Mədinədə dəvəsinə xurma toxumundan ot-ələf verəcəkdirlər. Büdeylin dəvəsinin çökdüyü yerə gedib, onun nəcisinin içinə baxıb dedi: "And olsun Allah-Təalaya, Büdeyl Məhəmmədin yanına gedibdir. Ondan sonra Əbu Süfyan oradan qalxıb, Mədinədə qızı Ümmü Həbibənin – peyğəmbərin xanımının mənzilinə daxil oldu. Peyğəmbərin oturduğu döşəkçənin üstündə oturmaq istəyəndə Ümmü Həbibə döşəkçəni oradan götürdü. Əbu Süfyan dedi: "Qızım, bu döşəkçə nədir ki, məndən bunu əsirgəyirsən? Ümmü Həbibə dedi: "Bu, peyğəmbərin döşəkçəsidir, sən müşrik, nəcis bir kişisən, bunun üstündə oturmana razı olmaram. Əbu Süfyan dedi: "Qızım, məndən sonra çox pis dəyişmisən. Oradan çıxıb, peyğəmbərin hüzuruna getdi. Müqaviləni yeniləyib, vaxtını uzatmaq istədiyini dedi. Peyğəmbər ona heç bir cavab vermədi. Oradan çıxıb, Əbu**

**Bəkrin yanına getdi. Peyğəmbərin onu əfv etməsi üçün Əbu Bəkirdən vasitəçi olmasını xahiş etdi. Əbu Bəkir – bu mənim işim deyil, mən belə işə qarışa bilmərəm, dedi. Oradan Ömər ibn Xəttabın yanına getdi. Ömərdən də eyni şeyi xahiş etdi. Ömər dedi: "Səndən ötrü mən yaxşı əfv istəyəcəm, vallah əgər qarışqadan başqa da özümə köməkçi tapa bilməsəm, yenə sizinlə cihad edəcəyəm. Oradan çıxıb, Əli ibn Əbu Talibin yanına getdi. Xanımı Fatimeyi-Zəhranın yanında oğlu Həsənlə oynamaqla məşğul idi. Dedi: "Ey Əli, qohumluq baxımından bu camaatın hamısından sən mənə yaxınsan. Bir istəyim var, ümisiz gəlmişəm, amma gərək ümidsiz qayıtmayam. Məndən ötrü peyğəmbərdən əfv istə. Əli dedi: "Ey Əbu Süfyan, peyğəmbəri elə bir niyyətdə görürəm ki, onunla danışmağa bizdə qüdrət yoxdur. Ondan sonra Əbu Süfyan Fatiməyə üzünü tutub dedi: "Ey Məhəmmədin qızı, bəlkə bu oğluna əmr edəsən ki, camaatın arasında (yəni Qüreyşlə Xüzaə və peyğəmbər arasında) sülh bağlasın. Dünyanın axırına kimi də ərəblərə ağa olsun. Pak Fatimeyi-Zəhra buyurdu: "Birincisi - mənim oğlum camaatın arasında sülh bağlamaq məqamına çatmayıb və ikincisi - heç bir şəxs peyğəmbərdən izinsiz ondan ötrü əhd bağlaya bilməz. Əbu Süfyan yenidən Hz. Əliyə dedi: "Ya Əbül-Həsən, mən belə görürəm, işlər çətinləşib, çarə yoxdur, mənə bir yol göstər. Hz. Əli buyurdu: vallah, sənə fayda verən bir şey bilmirəm, sən ki, Bəni-Kinanənin ağasısan. Get camaatın içində müqavilə bağladığını de, ondan sonra gəldiyin yerə get. Əbu Süfyan dedi: "Bu iş mənə bir fayda verərmi? Hz. Əli buyurdu: xeyr, vallah fayda verəcəyini zənn etmirəm, lakin sənin bundan başqa bir yolun yoxdur. Əbu Süfyan oradan çıxıb, məscidə gedib, camaatın arasında durub dedi: "Ey insanlar, mən sizinlə Qüreyş arasında sülh müqaviləsi bağladım ki, bundan sonra sizinlə savaşmasınlar. Bu sözü deyib, dəvəsinə minib, Məkkəyə tərəf yola düşdü. Gedib Məkkədə Qüreyşin yanına çatdı. Qüreyş camaatı ondan əhvalatı soruşdular. Məsələni nəql edib dedi: "Axırda Əlinin yanına getdim, Əlini onların hamısından təvazökar və mehriban gördüm. Mənə bir söz dedi, mən də ona əməl edib, qayıtdım. Bilmirəm, fayda verəcək, yoxsa yox. Dedilər: "O söz hansıdır? Dedi: "Əli mənə dedi ki, camaatın arasında sülh müqaviləsi bağladığını elan et, mən də o şəkildə hərəkət edib, qayıdıb gəldim. Dedilər: "Sənin müqaviləni təsdiq etdilərmi? Əbu Süfyan dedi: xeyr. Qüreyş dedi: "Əli sənə istehza edib, oynadıbdır, sənin dediyin söz nə fayda verəcək? Dedi: "Ondan başqa bir çarə tapmadım. Mədinədə Əbu Süfyan gedəndən sonra peyğəmbər camaata səfərə hazırlaşmağı əmr etdi və öz ailəsinə də ondan ötrü tədarük görmələrini əmr etdi. Lakin peyğəmbərin niyyətinin nə olduğuna agah olmayıb, səfər təchizatı ilə məşğul oldular. Əbu Bəkir öz qızının – möminlərin anası Aişənin yanına gedib dedi: "Qızım, peyğəmbər sizə səfərə hazırlaşmağı əmr edibmi? Dedi: "Bəli. Əbu Bəkir**

**dedi: “Bilirsənmi niyyəti nədir? Aişə dedi: vallah, bilmirəm. Ondan sonra peyğəmbər Məkkəni fəth etməyə niyyət etdiyini camaata elan edib, tez hazırlaşmalarını əmr etdi. Camaat da tədarüklə məşğul oldular. Səhabələrdən Hatib ibn Əbu Bəlta`a peyğəmbərin niyyəti haqda Məkkə əhlinə məktub yazdı. Seyfi ibn Əmrin kənizi Sara ilə məktubu yola saldı. Peyğəmbərin əmri ilə Hz. Əli bir neçə nəfərlə gedib, o kənizi tutub, kağızı ondan aldılar. Bu qissə Mümtəhinə surəsində, bu kitabın üçüncü cildində bəyan edilibdir. Oraya baxılsın. Camaat səfər tədarükünü görüb qurtarandan sonra peyğəmbərin əmri ilə Mədinədən çıxdılar. Sürətlə gedib, Məkkəyə bir qədər qalmış Mərrəzzəhran adlı yerdə dayandılar. Qüreyş camaatının heç bir şeydən xəbəri yox idi. Lakin qorxu içində olub, müsəlmanların hər an gələ biləcəyini gözləyirdilər. Buna görə də gecələr Əbu Süfyan ibn Hərb bir neçə nəfərlə Məkkənin ətrafında dolanıb, peyğəmbərdən xəbər öyrənmək istəyirdilər. O zamana qədər Məkkədə yaşayan Abbas ibn Əbdülmüttəlib - peyğəmbərin əmisi ailəsi ilə Mədinəyə gedəndə Mərrəzzəhranda peyğəmbərlə qarşılaşdı. Müsəlman ordusunun toplandığını görən kimi dedi: “Ey Qüreyş, səhər nə pis açılacaqdır. Əgər Qüreyş camaatı gəlib peyğəmbərdən aman istəməsə, bu qoşun zorla qalib gəlib, Məkkəyə daxil olsa, Qüreyş həlak olacaqdır. Mərrəzzəhranda on minlik islam qoşunu var idi. Abbas peyğəmbərin Beyza adlı qatırına minib, Məkkə tərəfinə yönəldi ki, bəlkə bir odun aparan, ya da hər hansı bir şəxs görsə, Məkkə əhlinə xəbər versin ki, gəlib peyğəmbərdən aman istəsinlər, ta ki, məhv olmasınlar. İslam ordusu hər tərəfi bağlayıb, bircə yerdən yol qoymuşdular. Hər tərəfdə kol-kosdan böyük tonqallar yandırıb, gəlib-gedənə baxırdılar ki, Qüreyşə xəbər getməsin. Abbas deyir: “Gecənin qaranlığında gedirdim, birdən Əbu Süfyanın səsini eşitdim. Yoldaşıyla danışıb deyirdi: “Bu gecəki kimi heç bir yerdə od görməmişəm. Yoldaşı ona dedi: “O Xüzaənın odudur. Əbu Süfyan dedi: Xüzaənin əhli azdır, bundan sonra belə odları olmaz. Bu zaman mən Əbu Süfyanın səsini tanıyıb dedim: “Əbu Hanzala! (Əbu Süfyanın ləqəbidir). O da mənim səsimi tanıyıb dedi: “Əbülfəzl. Dedim: “Bəli. Dedi: “Atam, anam sənə fəda olsun, nə xəbər var? Dedim: “Budur, Allahın Rəsulu on min nəfər müsəlmanla gəlir. Onlara qarşı durmağa gücünüz yoxdur. Dedi: “Bəs çarə nədir? Dedim: vallah, tutsalar, birinci səni öldürəcəklər. Çünki müqaviləni pozub, Xüzaə qəbiləsini qırıb, qarət etdiniz. Gəl, qatıra min ki, səni peyğəmbərin hüzuruna aparıb, səndən ötrü aman alım. Yoldaşı getdi. Abbas deyir: “Əbu Süfyanı qatıra mindirib, qoşunun içinə daxil oldum. Tonqalların arasından keçəndə mənə baxıb deyirdilər ki, peyğəmbərin əmisidir, peyğəmbərin qatırına minib. Bu şəkildə gedirdim ki, Ömər ibn Xəttabın yandırdığı tonqala yetişdim. Dedi: “Kimdir? Ayağa durub, mənə baxıb, arxa tərəfimdə Əbu Süfyanı gördü, dedi: “Allah-**

**Təalanın düşməni Əbu Süfyandır. Allah-Təalaya həmd edirəm ki, müqavilə bağlanmadan səni mənə verdi. Durub peyğəmbərin yanına qaçdı ki, Əbu Süfyanı öldürmək üçün izin alsın.** (Kaş ki, izin almış olsaydı). Abbas deyir: "Mən qatırı çapıb, onu keçdim, qatırdan düşüb, tez peyğəmbərin hüzuruna daxil oldum. Arxamca Ömər daxil olub dedi: "Ey peyğəmbər, izin ver, Allahın düşməni olan Əbu Süfyanın boynunu vurum. Dedim: "Ey peyğəmbər, mən Əbu Süfyana aman vermişəm, ondan sonra əyləşib, peyğəmbərin başından tutub dedim: "And olsun Allah-Təalaya, bu gecə məndən başqa heç kimi səninlə danışmağa qoymayacağam. Amma Ömər Əbu Süfyan haqqında çox danışanda dedim: Ömər, sakit ol. Əbu Süfyanın ona görə öldürmək istəyirsən ki, Əbdi-Mənaf nəslindəndir, əgər Bəni-Ədiy camaatından (Ömərin tayfası) olsaydı, onu öldürmək üçün belə israr etməzdin. Ömər dedi: "Abbas, sakit ol, and olsun Allah-Təalaya, o gün ki, sən islama daxil oldun, sənin müsəlman olmanı atam Xəttabın müsəlman olmasından (əgər islama daxil olsaydı) daha çox istəyirdim. Çünki bilirdim ki, peyğəmbər də sənin müsəlman olmanı atam Xəttabın müsəlman olmasından daha çox istəyirdi. (Ömərin bu sözündən məqsədi bu idi ki, mən qövmpərəst və qohumpərəstlik edən deyiləm, əgər elə olsaydım, atamın müsəlmanlığını sənin müsəlmanlığından çox istəyib, ona düşmən olana mən də düşmən olardım. Əbu Süfyanı peyğəmbər düşmən sayır, mən də o səbəbdən onu düşmən sayıram. Həqiqətən, Ömər belə bir şəxs idi). **Ondan sonra peyğəmbər buyurdu: "Ya Abbas, bu gecə Əbu Süfyanı aparıb çadırımda saxla, sübh tezdən gətir. Abbas deyir: "Əbu Süfyanı çadırıma götürüb, səhər də peyğəmbərin hüzuruna apardım. Elə ki, Əbu Süfyanı gördü, buyurdu: "Ey Əbu Süfyan, hələ o vaxt gəlməyib ki, Allah-Təalanın tək və şəriksiz, mənim də onun peyğəmbəri olduğuma inanasan? Əbu Süfyan dedi: "Atam, anam sənə fəda olsun, sənin lütfün və şəfqətin və qohumlara olan mərhəmətin lap çoxdur. Vallah, zənn edirəm, əgər Allah-Təaladan başqa bir məbud olsaydı, hər halda mənə bir fayda verərdi. Buyurdu: "Ey Əbu Süfyan, bəs mənim Allah-Təalanın peyğəmbəri olmağıma inanmağın vaxtı hələ gəlməyibmi? Əbu Süfyan dedi: "Atam, anam sənə fəda olsun, sənin lütfün və şəfqətin və qohumlara olan mərhəmətin lap çoxdur. amma sənin peyğəmbər olmağın barəsində hələ də şübhəm var. Peyğəmbər sakit oldu, lakin Abbas onu təhdid etdi ki, müsəlman ol, yoxsa əhdi pozduğuna görə səni öldürəcəkdir. Əbu Süfyan qorxusundan şəhadət deyib, islama daxil oldu. Hərçənd islama daxil olmaqda məcburiyyət yoxdur, lakin Abbasın Əbu Süfyanı islama daxil olması üçün qorxutmasının səbəbi əhdi pozduğuna görə öldürülməkdən qorumaq üçün idi. Abbas deyir: "Dedim, Ey peyğəmbər, indi ki, Əbu Süfyan islama daxil oldu, o, təriflənməyi sevən adamdır. Onun təriflənməsi üçün ona bir şey ver. Buyurdu: "Bəli, kim ki, Məkkədə Əbu Süfyanın evinə daxil olsa, amandadır və kim ki,**

**qapısını bağlayıb, öz evində əyləşsə amandadır və kim ki, Məscidül-harama daxil olsa, amandadır. Ondan sonra buyurdu: "Abbas, Əbu Süfyanı apar, iki dağın keçidində saxla ki, Allah-Təalanın ordusu onun qabağından keçsin. (Əbu Süfyan Məkkənin rəisi olduğuna görə onunla belə rəftar olundu. Hər bir ölkə fəth olunanda onun rəisi ilə belə rəftar olunar). Abbas deyir: "Əbu Süfyanı aparıb, peyğəmbərin dediyi yerdə saxladım, qəbilələr bir-bir öz rəngarəng bayraqlarıyla gəlib, onun qabağından keçirdilər.**

**Hər bir qəbilə keçəndə məndən soruşurdu, bu hansı qəbilədir? Mən deyirdim: "Bu Süleym qəbiləsidir. Əbu Süfyan deyirdi: "Mənim Süleym qəbiləsiylə nə işim vardır? O hər bir bir qəbiləni soruşub, mən cavab verəndə, o həmin kəlamı təkrar edirdi. Ta ki, qəbilələrin hamısı keçib, mühacir və ənsardan ibarət olan peyğəmbər ordusu hamısı dəmir zirehli geyimdə zahir oldular. Əbu Süfyan dedi: "Sübhanəllah, ya Abbas, bunlar kimdir? Dedim: "Bu peyğəmbər, bunlar da mühacir və ənsardır. Dedi: "Həqiqətən, ya Əbülfəzl, qardaşın oğlunun səltənəti böyük olubdur. Dedim: "Elə demə, səltənət deyil, peyğəmbərlikdir. Dedi: "İndi ki, sən deyirsən, qoy elə də olsun. Dedim: "Daha durma, Məkkəyə gedib, Qüreyş tayfasını qorxut ki, imana gəlsinlər, Əbu Süfyan sürətlə gedib, Məkkəyə varid oldu. Məscidül-haramda uca səslə səsləndi: "Ey Qüreyş camaatı, budur, Məhəmməd əhdi pozduğunuza görə o qədər qoşunla sizə tərəf gəlir ki, sizin o qoşuna qarşı durmağa gücünüz yoxdur. Qüreyş dedi: "Bəs çarə nədir? Əbu Süfyan dedi: "Məhəmməd belə əmr verdi ki, kim ki, Əbu Süfyanın evinə daxil olsa, amandadır. Qüreyş camaatı dedi: tək sənin evin bizə nə fayda verər? Dedi: "Yenə buyurubdur: "Kim məscidə daxil olsa amandadır və kim ki, qapısını bağlayıb, evində otursa amandadır. Bu sözləri eşidəndə camaat dağılıb, məscidə və evlərinə daxil oldular. O biri tərəfdən peyğəmbər (ə.s) Zübeyr ibnül-Əvvamı mühacir və ənsara əmir təyin edib, özünə məxsus olan bayrağını ona verib əmr etdi ki, Məkkənin yuxarı tərəfində Hacun adlı yerdə bayrağı dikərsən. Buyurdu: "Mən gələnə kimi bayrağı dikdiyin yerdən bir addım da uzaqlaşma. Ondan sonra peyğəmbər (ə.s) Məkkənin daha yaxşı görüldüyü Zituva adlı yerə getdi. Kəbə Məkkə evlərinin əhatəsində olduğu halda peyğəmbər şəhəri müşahidə etdi. O cənab təvazösündən dəvə üstündə Allaha şükür səcdəsi etdi. Ondan sonra Məkkəyə daxil olub, Zübeyr duran yerdə çadırını qurdu. Məkkənin aşağı tərəfində Qüreyşin təhriki ilə Bəni-Bəkir camaatı Məkkə ətrafında məskun olan Əhabişdən bir qrupla toplanıb, savaşmaq üçün durmuşdular. Həmçinin Süfyan ibn Ümeyyə, İkrimə ibn Əbu Cəhl və Süheyl ibn Əmr bir qədər camaatla Xəndəmə adlı yerdə, Məkkənin aşağı tərəfində savaşa hazırlaşmışdılar. Peyğəmbər Xalid ibn Vəlidi Qüzaə və Bəni-Süleym müsəlmanlarına əmir təyin edib, Məkkənin**

aşağı tərəfindən daxil olmağı əmr etdi. Peyğəmbər (ə.s) Zübeyr və Xalidi göndərəndə buyurdu: “Sizinlə savaşa başlayanlardan başqası ilə vuruşmanıza izin yoxdur. Ənsardan Sə`d ibn Übadəyə əmr verdi: “Bir qədər qoşunla Məkkənin Kəda adlı yerindən daxil olsun. Sə`d ibn Übadə qoşunu götürüb yola düşəndə dedi: “Bu gün savaş günüdür. Qadağalar götürülüb, savaşın halal olan gündür bu gün. Bu sözü mühacirlərdən biri eşidib, peyğəmbərə xəbər verib dedi: “Ey peyğəmbər, Sə`d ibn Übadə Qüreyşə həmlə edib, qətl və qarət etməkdən amanda deyilik. Peyğəmbər (ə.s) Əli ibn Əbu Talibə buyurdu: “Sə`d ibn Übadənin yanına gedib, qoşuna əmirlik elə, Məkkəyə Kədadan daxil ol. Məkkənin Zübeyr gedən yuxarı tərəfində savaş olmayıb, bir nəfər də Qüreyşdən ona müxalif çıxmadı.

Gedib peyğəmbərin bayrağını Hacun adlı yerdə dikdi. Amma Məkkənin Xalid ibn Vəlidin girdiyi aşağı tərəfində Bəni Bəkir və Əhabiş camaatı ona qarşı çıxıb, bir qədər savaşsalar da, məğlub oldular. Allah-Təala onları dağıdıb, Xalid Məkkəyə daxil oldu. Bu savaşdan başqa Məkkənin fəthi zamanı başqa savaş olmadı. Hər bir tərəfdən islam qoşunu Məkkəyə daxil olub, camaatı təskin edib, rahatlatdılar. Ondan sonra peyğəmbər dəvəyə minib, Kəbəyə getdi. Dəvənin üstündə Kəbəni yeddi dəfə təvaf edib, hər bir təvafda əlindəki ağacını qara daşa sürtüb, təvafını bitirdi. Təvafdan sonra Kəbənin qapıçısı Qüreyşin Bəni-Əbdüddar camaatından olan Osman ibn Talhanı çağırtdırıb, Kəbənin açarını ondan alıb, qapını açdırıb, Kəbənin içinə daxil oldu. Ağacdan hazırlanmış göyərçin heykəlini gördü. Öz əli iulə onu sındırıb çölə atdı, ondan sonra qayıdıb qapıda durdu. Məscidül-haram aman üçün gəlmiş Qüreyş camaatıyla dolu olub, hamısı daş kimi sakit dayanmışdılar. O cənab üzünü onlara tutub, Allah-Təalaya həmd edəndən sonra buyurdu: “Ey Qüreyş camaatı, Allah-Təala cahiliyyə zamanının təkəbbür və qürurunu və ata-babanızla fəxr etməyi sizdən götürdü. İnsan Adəm övladıdır. Adəm torpaqdan yaradılmışdır. Ondan sonra ayəni oxudu: “Ey insanlar! Mən sizi bir kişi ilə bir qadından yaratdım”. Ondan sonra buyurdu: “Ey Qüreyş camaatı, küfr və şirk içində qalıb, mənə və müsəlmanlara etdiyiniz əziyyətin və əhdi pozmanızın müqabilində fikriniz nədir, sizinlə necə rəftar edəcəyəm? Dedilər: “Bizim zənnimizcə bizimlə yaxşı rəftar edəcəksən. Sən möhtərəm qardaşımızsan və möhtərəm qardaşımızın oğlusan. Bizə hakim oldun, güzəşt elə. Buyurdu: “Bu gün mən o sözü deyirəm ki, qardaşım Yusif Misirdə qardaşlarına demişdi: “Bu günkü gündə sizə mənim tərəfdən heç bir məzəmmət yoxdur, Allah-Təala sizi bağışlasın. Gedin, hamınızı azad etdim. Məkkə zorla fəth olunduğuna görə gərək orada olan müşriklər qulam olaydılar. Lakin peyğəmbər onları azad etdi və bu səbəbdən onlara “tülaqi” deyilir. Ondan sonra peyğəmbərin əmri ilə bütün bütləri və ibadətdən ötrü dikilən böyük daşların hamısını sındırıb,

إِذَا جَآءَ نَصْرُ اللّٰهِ وَالْفَتْحُۙ ﴿١﴾ وَرَاَيْتَ النَّاسَ يَدْخُلُونَ فِي دِينِ اللّٰهِ اَفْوَاجًاۙ ﴿٢﴾ فَسَبِّحْ بِحَمْدِ رَبِّكَ وَاسْتَغْفِرْهُۜ اِنَّهُ كَانَ تَوَّابًا ﴿٣﴾

---

**dağıtdılar. Kəbənin damında sarı şüşədən bir büt var idi. Əli ibn Əbu Talibi dama çıxarıb, o bütü oradan atıb, parça-parça etdilər. Allahın evi olan Kəbəni bütlərdən təmizləyib, oranı tövhid evi etdi. Oradan çıxandan sonra peyğəmbər gedib, Sinaya qalxıb, dua oxumağa başladı. O əsnada orada olan ənsar - Mədinə əhli bir-birinə dedi: "Məkkə peyğəmbərin vətənidir. burada anadan olub, indi ki, fəth olundu, ya bizi qoyub, burada qalacaq, ya da ki, Mədinəyə qayıdacaq. Peyğəmbər duanı bitirəndən sonra buyurdu: "Nə danışırdınız? Dedilər: "Bir şey danışmırdıq. Peyğəmbər israr edəndən sonra fikirlərini dedilər. Buyurdu: "Allah qorusun, mənim həyatım sizin həyatınız, mənim ölüm sizin ölümünüzdür. Mən sizi tərk edib, burada qalan deyiləm. Ənsar sevinib, şadyanalıq etdi. Ondan sonra peyğəmbər (ə.s) on beş gün Məkkədə qalıb, orada Əttab ibn Əsidi hakim qoyub, oradan Həvazin və Hüneyn tərəfinə yola düşdü. Hüneyn qissəsi Bəraət (Tövbə) surəsində qeyd olundu, oraya baxılsın. Məkkənin fəthi qissəsi müxtəsər şəkildə nəql edildi.**

**1) (إِذَا جَآءَ نَصْرُ اللّٰهِ وَالْفَتْحُۙ)** - (Ey Məhəmməd), **o zaman ki, Allah-Təalanın fəth və qələbəsi** (Məkkə barəsində) **sənə gəldi,** (Məkkəni) **fəth edib, müşriklər zəlil olub, mənim hərəmim şirkdən pak oldu,**

**2) (وَرَاَيْتَ النَّاسَ يَدْخُلُونَ فِي دِينِ اللّٰهِ اَفْوَاجًاۙ) insanlar islama tək-tək daxil olandan sonra onların dəstə-dəstə Allahın dini olan islama daxil olduğunu gördün,** (elə ki, peyğəmbər Məkkəni fəth etdi, insanlar öz ixtiyarları ilə ətraf bölgələrdən dəstə-dəstə gəlib, islama daxil olmağa başladılar).

**3) (فَسَبِّحْ بِحَمْدِ رَبِّكَ وَاسْتَغْفِرْهُۜ اِنَّهُ كَانَ تَوَّابًا)** - (Ey Məhəmməd), **Allah-Təalanın belə böyük bir fəthi səndən ötrü asan şəkildə müyəssər etməsinə görə rəbbin Allah-Təalaya həmd-səna edib, onu pak və müqəddəs, hər bir eyib və şübhədən uca sayıb, bağışlanmanı istə. Həqiqətən, Allah-Təala insanları yaradandan bəri tövbə edənlərin tövbəsini qəbul edib, onların günahlarını bağışlayandır. Habelə sənin də tövbəni qəbul edib, bağışlayacaqdır.** (Bu surə Mədinədə, Məkkənin fəthindən əvvəl nazil olub, iki şeyə işarə olunur: "Birincisi – peyğəmbərə və möminlərə Məkkənin fəthi müjdəsi verilir, ikincisi – peyğəmbərin vəfatının yaxınlaşmasına işarə edir. O işarə peyğəmbərin Allahdan bağışlanmasını istəməsi əmridir. Elə ki, bu surə nazil oldu, peyğəmbər bu surəni Mədinədə səhabələrinə oxudu, surədə Məkkənin fəthinə işarə olunduğuna görə səhabələr sevinib, şadyanalıq etdilər. Lakin peyğəmbərin əmisi Abbas ağladı. Peyğəmbər (ə.s) buyurdu: *"Ey əmi, səni nə*

*ağlatdı? Dedi: "Ey peyğəmbər, bu surədə ki, Allah-Təala sənə bağışlanmanı istəməni əmr edir, demək sənin ölümünün yaxınlaşdığını xəbər verir. Buyurdu ki, necə ki, deyirsən, etdir. Mənim ölümüm yaxınlaşıb. Peyğəmbər qızı Fatimeyi-Zəhranı çağırıb dedi: "Qızım, mənim nəfəsim ölüm xəbərini verir. Fatimeyi-Zəhra ağladı. Buyurdu: "Qızım, ağlama, mənim əhli-beytimdən mənə ilk qovuşan sən olacaqsan.* Ondan sonra peyğəmbər iki il ömür sürüb, sonra axirətə köçdü. Pak ruhuna Allahdan salam olsun! Bu surə hicrətin 8-ci ilində nazil olub, həmin ildə Məkkə fəth olundu. Hicrətin 10-cu ilində peyğəmbər vəfat etdi.

Allaha həmd olsun, ən-Nəsr surəsinin təfsiri tamamlandı. Peyğəmbər buyurdu: *"Kim ən-Nəsr surəsini oxusa, Məkkənin fəthində peyğəmbərlə birlikdə olanların savabı qədər ona savab verilər."*

## TƏBBƏT (ƏBU LƏHƏB) SURƏSİ

111-cu surədir. Məkkədə nazil olub, 5 ayə, 20 kəlmə və 77 hərfdir.

تَبَّتْ يَدَآ اَبِي لَهَبٍ وَتَبَّ ﴿١﴾ مَآ اَغْنٰى عَنْهُ مَالُهُ وَمَا كَسَبَ ﴿٢﴾

### Bismillahir-Rəhmanir-Rəhim

**1) (تَبَّتْ يَدَآ اَبِي لَهَبٍ وَتَبَّ) - Əmin* Əbu Ləhəbin əlləri (hansı ki, onlarla sənə daş atırdı) həlak olsun, amma** (Əbu Ləhəbin) **xəbəri yoxdur ki, səni, haqqı inkar etdiyi üçün həlak olub, bizim əbədi əzabımıza düçar olacaqdır. Sənə əziyyət etməklə sənin əcr və savabın, onun ziyan və əzabı artıq olar. Əbu Ləhəb peyğəmbərə daş atıb ayağını yaraladı. Arvadı da gecələr peyğəmbərin qapısına və onun keçdiyi yola çör-çöp və tikan tökürdü. Surə bu haqda nazil olub, onların küfrünü və əbədi olaraq əzaba düçar olacaqlarını isbat etdi).**

**(*Qeyd:** *"Əbu Ləhəb peyğəmbərin əmisi, Əbdülmüttəlibin oğludur. Əbu Ləhəb ləqəbidir, adı Əbdülüzzadır. Məkkədə olan Üzza bütünün qulamı sayılıb, onun adı qoyulubdur. Peyğəmbərin əcdadlarına və Əbdülmüttəlibə müvəhhid deyənlərin cavabı övladlarına qoyduqları addan məlum olur. Necə ki, böyük babası Haşimin atasını Məkkədə olan Mənaf adlı bütə qulam sayıb, onun adını – Əbdi-Mənaf qoymuşdular. Əbu Ləhəbin arvadı Ümmü Cəmil Hərb qızı – Əbu Süfyanın bacısıydı. Bunlar ər-arvad peyğəmbərdən heç bir əziyyəti əsirgəməyib, küfr və inadlarında möhkəm idilər. Hz. Məhəmməd peyğəmbər olmadan əvvəl bir qızını Əbu Ləhəbin oğlu Utbəylə evləndirmişdi. ən-Nəcm surəsi peyğəmbərə nazil olanda Utbə gedib peyğəmbərin üzünə tüpürdü. ən-Nəcm surəsinə kafir oldum deyib, qızını boşayıb, qaytardı. Peyğəmbər ona bəddua edib, Şam yolunda bir şir onu öldürdü. ən-Nəcm surəsinin təfsirində bu qissə bəyan olunubdur).*

**2) (مَآ اَغْنٰى عَنْهُ مَالُهُ وَمَا كَسَبَ) -** (Ey Məhəmməd), (Əbu Ləhəbin) **malı və qazandığı şər və xəbis əməlləri ona heç bir fayda verməyib, dünya və axirətdə əzaba düçar olub, nicat tapmayacaqdır.** (Ərəblər arasında tauna bənzər ədəsə (dəri xəstəliyi) adında bir xəstəlik yayılmışdı ki, ərəblər ondan taun kimi qorxardılar. Əbu Ləhəb Bədir savaşından sonra bu xəstəliyə yaxalanıb, Məkkədə həlak oldu. O xəstəliyin qorxusundan hətta oğlanları da ona yaxın durmayıb, iyrənirdilər. Onun xəbis meyiti üç gün ortada qalıb iy verdi. Axırda xalqın məzəmmətindən bezib, ayağına ip bağlayıb, çəkib Məkkənin kənarındakı bir yerə atıb, gedib-gələnlərin də üstünə daş atması ilə ora təpəyə

سَيَصْلَىٰ نَارًا ذَاتَ لَهَبٍ ﴿٣﴾ وَامْرَأَتُهُ حَمَّالَةَ الْحَطَبِ ﴿٤﴾ فِي جِيدِهَا حَبْلٌ مِنْ مَسَدٍ ﴿٥﴾

---

çevrildi. Onun axirətdəki əzabına da Allah-Təala özü agahdır).

**3) (سَيَصْلَىٰ نَارًا ذَاتَ لَهَبٍ) - Əbu Ləhəb axirətdə şiddətli bir alova daxil olub, əzaba düçar olacaqdır.**

**4) (وَامْرَأَتُهُ حَمَّالَةَ الْحَطَبِ)** (Əbu Ləhəbin) **arvadı** (Ümmü Cəmil) **də həmin yerə onunla bərabər daxil olacaqdır. Çünki onun işi-gücü ancaq peyğəmbərimizin ayaqları altına çör-çöp və tikan tökmək idi.**

**5) (فِي جِيدِهَا حَبْلٌ مِنْ مَسَدٍ) - Boynundakı möhkəm iplə tikan gətirib, peyğəmbərin yolunun üstünə tökürdü ki, gecə vaxtı evdən çıxanda ayaqlarını yaralasın. Neçə dəfə peyğəmbərin mübarək ayaqları bu tikanlardan yaralandı). Həmin ip qiyamət günündə onun boynunda oddan zəncir olub, özü də atəşin içində olacaqdır. Peyğəmbərin Məkkədə nə qədər əziyyət çəkdiyi buradan məlum olur. Bir halda ki, onun əmisi və əmisi arvadı, onların oğulları ona belə əziyyəti rəva görürdülər, gör digər insanlar ona nə qədər əzab edib, Allah-Təala buna agahdır. Cənab İsanın (ə.s) dediyi kimi: "Hər peyğəmbər öz qövmünün arasında zəlil olar. Uca peyğəmbərimiz Məkkədə çox zillətlə dolanırdı. Xüsusən himayədarı Əbu Talib vəfat edəndən sonra, elə ki, hicrət edib, Mədinəyə getdi, işləri gündən-günə tərəqqi edib, islam dini də dünyada yayılmağa başladı.**

Allaha həmd olsun, Təbbət (Əbu Ləhəb) surəsinin təfsiri tamamlandı. Allahın Rəsulu (ə.s) buyurdu: *"Kim Təbbət surəsini oxusa, ümidvaram ki, Allah-Təala o şəxsi məhşərdə Əbu Ləhəb ilə bir yerdə məskun etməz."*

## İXLAS SURƏSİ

112-cu surədir. Məkkədə nazil olub, 4 ayə, 15 kəlmə və 47 hərfdir.

قُلْ هُوَ اللّٰهُ اَحَدٌ ۚ ﴿١﴾ اَللّٰهُ الصَّمَدُ ۚ ﴿٢﴾ لَمْ يَلِدْ وَلَمْ يُولَدْ ۙ ﴿٣﴾ وَلَمْ يَكُنْ لَهُ كُفُوًا اَحَدٌ ﴿٤﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

İbn Abbas deyir: "Müşriklər Məkkədə peyğəmbərə dedilər: "Ey Məhəmməd, o yeganə olan Allah-Təala ki, bizi onun ibadətinə və tövhidinə dəvət edirsən, onu bizdən ötrü vəsf edib, bəyan et. O vaxt bu mübarək surə nazil oldu".

**1) (قُلْ هُوَ اللّٰهُ اَحَدٌ ۚ)** - (Ey Məhəmməd), **müşriklərin cavabında de ki, o Allah-Təala ki, sizi onun tövhid və ibadətinə dəvət edirəm, tək və ikincisi yoxdur. O bütlər ki, onları Allah-Təalaya şərik qoşursunuz, batildirlər və şərik olmağa qabil və layiq deyildirlər. Bütün varlıq onun məxluqatı olduğuna görə ona şərik qoşmaq ağıl və insafdan kənardır.**

**2) (اَللّٰهُ الصَّمَدُ ۚ) - O Allah-Təala ki, onu tanıyıb, göylərin və yerin yaradıcısı olduğunu iqrar edirsiniz, həmin Allah-Təala tanrılıqda tək, şəriksiz, insanlar da bütün işlərində ya könüllü, ya da məcburi olaraq ona möhtacdırlar.**

**3) (لَمْ يَلِدْ وَلَمْ يُولَدْ ۙ) - O, heç bir məxluqla həmcins deyil, Onun xanımı olmaz, o ikisindən övlad əmələ gəlməz və özünün də vücudu əzəli olduğuna görə cism olmaqdan pak olub, ata və anadan doğulmayıbdır. Çünki hər bir doğulan cismdir və sonradan yaradılmışdır.**

**4) (وَلَمْ يَكُنْ لَهُ كُفُوًا اَحَدٌ) O, görülməz, lakin Onu bilinən şeylər ilə tərif və vəsf edərlər. Allah-Təalanın heç bir bənzəri, oxşarı və özünün də surəti olmadığından Onun həqiqi müqəddəs zatını olduğu kimi vəsf edib, tanıtdırmaq imkansızdır. Bu qeyd olunan vəsflərlə Onu tanımaq kifayət edər. Bu surənin fəziləti və Quranın üçdə birinə bərabər olması haqqında peyğəmbərdən çoxlu hədis nəql edilibdir. Bu fəzilətin səbəbi surənin Allah-Təalanın tövhidini və sifətlərini ehtiva etməsindəndir. Hər bir işin şərəfi o elmlə məlum olan işin şərəfinə müvafiqdir. Allahın tövhidindən və ilahi sifətlərindən daha şərəfli bir şey olmadığına görə onların elmi də digər elmlərdən şərəflidir. Bu mübarək surə başdan-ayağa tövhid və ilahi sifətlərdən bəhs etdiyi üçün Quranın üçdə birinə bərabər sayılıb.**

## *İxlas surəsi*

**Hərçənd digər surələr də tövhid və ilahi sifətləri ehtiva edir, lakin bu surə sırf tövhid və ilahi sifətlərdən ibarət olduğuna görə digər surələrdən bir qədər üstünlüyə və mənəvi ülvi dərəcəyə sahibdir.**

Allaha həmd olsun, İxlas surəsinin təfsiri tamam oldu. Allahın Rəsulu (ə.s) bir kişinin "De ki, Allah birdir" ayəsini oxuyan görüb dedi: *vacib oldu.* Dedilər: "Ey peyğəmbər, nə vacib oldu? Buyurdu: *"Cənnət vacib oldu. Zənn etməyin ki, bizim də "De ki, Allah birdir"* ayəsini oxumamızla cənnət bizə vacib olar. Heyhat, dil lağlağı, qəlb də oxuduğundan qafil olanda cənnət yox, cəhənnəm vacib olar. Çünki Allah-Təalanın tövhidini və ilahi sifətlərini ehtiva edən belə fəzilətli surəni şüursuz şəkildə oxuyub, Allah-Təalanın tövhidinə və ilahi sifətlərinə agah olmamaq, istehza edilməyə layiqdir. Belə şəxslərə cəhənnəm layiqdir, nəinki cənnət. Xüsusən surədəki hərflərin ərəbcədəki düzgün oxunuşuna diqqət edib, mənasından qafil olanlar sadəcə oxunuşa diqqət etməklə, özlərini kamil insan hesab edib, Haqq-Təalaya layiq sayırlar. Çox təəccüblüdür.

## FƏLƏQ SURƏSİ

113-cu surədir. Mədinədə nazil olub, 5 ayə, 23 kəlmə və 74 hərfdir.

قُلْ اَعُوذُ بِرَبِّ الْفَلَقِۙ ﴿١﴾ مِنْ شَرِّ مَا خَلَقَۙ ﴿٢﴾ وَمِنْ شَرِّ غَاسِقٍ اِذَا وَقَبَۙ ﴿٣﴾ وَمِنْ شَرِّ النَّفَّاثَاتِ فِي الْعُقَدِۙ ﴿٤﴾

**Bismillahir-Rəhmanir-Rəhim**

Allah-Təala bu mübarək surədə bütün məxluqatın şərirlərinin şərindən və bəzi xüsusi şərlərdən Allah-Təalaya sığınıb, pənah aparmağı peyğəmbərinə əmr edir, lakin həqiqətdə bunu ümmətinə əmr edib, belə xəbis işlərdən çəkinib, onları tərk etməyi tövsiyə və təlim edir.

**1-2) (قُلْ اَعُوذُ بِرَبِّ الْفَلَقِۙ مِنْ شَرِّ مَا خَلَقَۙ)** - (Ey Məhəmməd), **vird edib, qeyd olunan şərirlərin şərindən Allah-Təalaya pənah apar. Lakin sadəcə dillə vird etmək kifayət deyil, qəflət içində olan şərirlərdən də qaç ki, onların şəri sənə toxunmasın. De ki, qaranlığı yarıb işıqlıq verən şəxsin rəbbi Allah-Təalaya özünün yaratdığı şərirlərin şərindən pənah aparıb, yardım istəyirəm.** (Ayədə sübhün qeyd edilməsi nur və hidayət tərəfinə meyl etməyə, xüsusən surədə qeyd olunan pisliklərə agah olub, onlardan qaçmağa işarədir. Qurani-Şərifin açıq-aydın ayələri nə gözəl işarələri ehtiva edir. Amma bəsirətimiz kor olub, onları dərk etməkdən acizik. Hər bir şeydə elm lazımdır, o pisliklərdən agah olmayan şəxs onlardan çəkinməyib, bilmədən şər əməllərə düçar olub, dünya və axirətdə fəlakətə məruz qalar).

**3) (وَمِنْ شَرِّ غَاسِقٍ اِذَا وَقَبَۙ)** - (Ey Məhəmməd), **yenə de ki, aləmi bürüyən gecənin zülmətindən Allah-Təalaya pənah aparıram.** (Pisliklərin əksəriyyəti gecə vaxtı, xüsusən gecənin qaranlığında vaqe olduğundan müsəlman şəxs özünü o pisliklərdən mühafizə edib, gecənin qaranlığından çəkinməlidir).

**4) (وَمِنْ شَرِّ النَّفَّاثَاتِ فِي الْعُقَدِۙ)** (Yenə de ki, Ey Məhəmməd), **falçılıq edib, düyünlərə üfürüb bağlayanların, xalqı aldadanların şərindən Allah-Təalaya pənah aparıram.** (Həqiqətən, adlarını falçı, sehrbaz, ya da ki, kitaba baxıb dua yazanlardan artıq şərir və fasiq şəxslər yoxdur. Bunlar quldurlardan, qatillərdən, sərxoşlardan daha artıq şərir və fasiqdirlər. Çünki quldur və qatillərin əməllərinin zərəri ancaq insanlara və onların mallarına olub, xalqın din və ayininə onlardan ziyan gəlməz. Lakin falçıların zərəri islama olub, camaatı tövhiddən küfr və şirkə çəkib, zülmət və cəhalətə düçar edirlər. Bir gün boşanma davası ilə əlaqəli bir şəxs yanıma gəldi, ərizəsini təqdim edəndən sonra

وَمِنْ شَرِّ حَاسِدٍ إِذَا حَسَدَ ﴿٥﴾

bəyan etdi ki məni filan ağa sizin yanınıza göndərdi. Mən o şəxsə dedim: “Sizin o ağa ilə nə əlaqəniz vardır? Dedi: “Bizim bir uşağımız vardır, naxoşdur, hər iki gündən bir gərək onun yanına aparım. Ağa mənə dedi ki, əgər istəyirsən uşağın tam yaxşı olsun, gərək on beş manat verəsən, dua yazım. Mənim on beş manatım olmadığından məcburam ki, iki gündən bir onun yanına aparım. Ya Allah, bundan da artıq zəlalət və cəhalət olarmı? Belə yalan və batil sözlər və əməllər xalqın qəlbinə elə yayılıbdır ki, onları təmizləmək də mümkün deyildir və bu səbəbdən Allah-Təala bu mübarək surədə onların şərindən qorunmağı əmr edir. Bundan artıq pislik və zəlalət olmaz).

**5) (وَمِنْ شَرِّ حَاسِدٍ إِذَا حَسَدَ)** (Bir də de ki, Ey Məhəmməd), **paxıllıq edən şəxsin paxıllıq etməsindən Allah-Təalaya pənah aparıram.** (Həqiqətən, xəbis sifətlərin ən pisi həsəd etməkdir. Həsəd etmək, yəni başqalarında olan nemətlərin yox olmasını istəyib, onlara pis gözlə baxıb, məhv etməyə çalışmaq böyük bir xəstəlik olub, ilk öncə paxılın özünə zərərdir, belə xəstəliyi müalicə etmək lazımdır. Nə gözəl öyüd-nəsihətləri ehtiva edən və əxlaqsızlığı tərk etməyə çağıran bir surədir. Biz müsəlmanların belə ayələrin uca məzmunundan qafil olması təəccüblüdür. Allah-Təala yuxarıda qeyd olunan şeytan sifətli zəlil və rəzil hiyləbazların kökünü biz müsəlmanların arasından yox etsin. Amin!)

## ən-NAS SURƏSİ

114-cu surədir. Mədinədə nazil olub, 6 ayə, 20 kəlmə və 79 hərfdir.

قُلْ اَعُوذُ بِرَبِّ النَّاسِۙ ﴿١﴾ مَلِكِ النَّاسِۙ ﴿٢﴾ اِلٰهِ النَّاسِۙ ﴿٣﴾ مِنْ شَرِّ الْوَسْوَاسِ الْخَنَّاسِۙ ﴿٤﴾
اَلَّذ۪ي يُوَسْوِسُ ف۪ي صُدُورِ النَّاسِۙ ﴿٥﴾ مِنَ الْجِنَّةِ وَالنَّاسِ ﴿٦﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

Allah-Təala bu mübarək surədə bir xəbis sifətin şərindən Allah-Təalaya pənah aparmağı möhtərəm peyğəmbərinə əmr edir, lakin əslində ümmətinə bu mübarək surəyə hər zaman sarılıb, xəbis xəbərçilik sifətini tərk etməyi əmr edir. Bu xəbis sifət bundan ona, ondan buna söz aparıb, fitnə çıxarıb, insanları fəlakətə salmaqdır.

**1-3) (قُلْ اَعُوذُ بِرَبِّ النَّاسِۙ مَلِكِ النَّاسِۙ اِلٰهِ النَّاسِۙ) -** (Ey Məhəmməd), **dilinlə vird edib, bundan sonra qeyd olunan şərirlərin şərindən Allah-Təalaya pənah apar. Lakin təkcə pənah aparmaqla kifayətlənmə, fəzilət məqamına götürüb ümmətinə də sənə tabe olmağı əmr et. De: "İnsanların rəbbi, mürəbbisi, hər bir işlərinin maliki və haqq olan məbudları Allah-Təalaya pənah aparıram.** (Səbəbi gələcək ayədə qeyd olunur).

**4-6) (مِنْ شَرِّ الْوَسْوَاسِ الْخَنَّاسِۙ اَلَّذ۪ي يُوَسْوِسُ ف۪ي صُدُورِ النَّاسِۙ مِنَ الْجِنَّةِ وَالنَّاسِ) - Cinlərdən və insanlardan xəbərçilik edib, söz gəzdirib,** (kirpi) **kimi fürsət tapanda baş çıxarıb, insanların qəlblərinə fitnə-fəsad salan, fürsət tapmayanda acizanə şəkildə bir guşədə gizlənib, qəlblərə vəsvəsə salıb, söz gəzdirənlərdən sənə pənah aparıram, ey Allahım.** (Həqiqətən, xəbərçilik nə pis və qəbih sifətdir, ondan böyük fəsadlar törəyir. Neçə yerdə Qurani-Şərifdə və hədislərdə bu hərəkət qınanıb, onun sahibləri fasiq və günahkar adlanıb. Quran əhli gərək ayələrdəki belə əmrlərə əməl edib, xəbis sifətləri dəf edib, gözəl sifətlərə yönəlməklə nəfslərini təmizləyib, insanlıq məqamına yüksəlsinlər. Nəinki özümüzə Quran əhli deyib, ancaq Qurani-Şərifdən heç istifadə etməyib, vəhşilik və zəlalətə düşüb, insanlıqdan uzaqlaşıb, heyvanlar aləminə daxil olaq).

**Allaha həmd olsun, bu mübarək surənin təfsiri tamamlandı. Allahın Rəsulu** (ə.s) **buyurdu:** *"Kim bu son iki surəni (Müəvvizəteyn-İxlas, Nas) oxusa, Allah-Təalanın nazil etdiyi kitabların hamısını oxumuş kimidir. Allahın Rəsulu (ə.s) doğru buyurub)*.

Mən həqir kitab müəllifinin bu təfsirə görə nəql etdiyim hədis çox müvafiq və haqq bir hədisdır. Çünki bu surələrdə qeyd olunan şərirlərin şərindən qaçmaq ilahi kitabların hamısında bəyan olunub və tərk edilməsi əmr olunubdur. Lakin təfsirçilərin, xüsusilə Əşəri məzhəbi alimlərinin təfsirindəki bu hədisdən və yozumlardan mühüm bir fayda görünmür. Çünki onlar surələri sehrbazların sehrinin həqiqət olması və şeytanın insana vəsvəsə edib, yoldan çıxartması şəklində təfsir ediblər və surələrin nazil olması səbəbi kimi bir hadisəni nəql ediblər. Peyğəmbər (ə.s) bir dəfə xəstələnmişdi. Bunun səbəbi kimi ona bəzi nalayiq hərəkətlər isnad etdilər. Mən həqir onları qeyd edirəm: "Naxoşluğunun səbəbi məlum olmadı. Cəbrayıl, ya da ki, başqa bir mələk gəlib peyğəmbərə dedi ki, sənə cadu ediblər. Filan yəhudi sənin tükündən qoparıb, düyün vurub filan quyuya salıbdır. Allah-Təala bu surələri sənə göndərdi ki, oxuyub şəfa tapasan. Peyğəmbər adam göndərib, həmin quyudan bir düyünçə çıxartdılar. İçində bəzi şeylər və peyğəmbərin başının tükü var idi, (necə ki, indi də falçılar belə düyünçələr hazırlayırlar) Peyğəmbər surələri o düyünə oxuyub, düyünlər açıldı, peyğəmbər də şəfa tapdı". Bu mövzuda ağla zidd olan xeyli hədislər nəql edib, məqalələr yazıblar. Onları nəql etməkdən üz döndərdim, lakin belə sözlərin doğruluğunu və fəsadını ağıl sahibi şəxslərin rəyinə həvalə etdim. Hərçənd bəzi bədniyyət adamlar bu kitaba baxıb deyəcəklər ki, bu sözlər təfsirçilərin sözlərinə müvafiq deyildir. Mən həqir onların cavabında deyirəm: "Mənim təfsirimdə qeyd etdiyim mətləblərin hansı şəriətə və ağla ziddir? Əksinə, Quranın etibarını və ecazkarlığını sübut edən mənalardır. Təfsirçilər guya öz zamanələrində olan falçıların əməllərinə baxıb, belə mənasız, hətta peyğəmbərə layiq olmayan şeyləri o cənaba isnad ediblər. Allah məni qorusun ki, mən həqir elə nalayiq sözləri və bir yəhudi qadının cadusu ilə cənab peyğəmbərin tilsimlənməsini ona isnad edim. Əgər sehrin həqiqəti olub, o cənaba təsir etsəydi, bir an da o uca şəxsiyyəti yer üzündə hərəkət etməyə qoymazdılar. Bu sözlərin hamısı cəhalət və nadanlıqdan meydana gəlib. Allahım, ayələrini anlamada bizə yardım et və bizi kitabınla əməl etməkdə sabit elə!

"Kəşfül-Həqayiq"in üçüncü cildini tamamladığım və bu xeyir əmələ axıra kimi məni müvəffəq etdiyi üçün Allah-Təalaya həmd-səna edib, təşəkkürlər edirəm. Bu axır vaxtlarda mən həqirə xeyli qəm-qüssə, kədər üz verdi... Bu kitabı tamamlaya bildiyim üçün ağacların yapraqları, dənizlərin suları, çöllərin qumları qədər, səma və yer durduqca, günəş yeri işıqlandırdıqca, ay günəşdən nur aldıqca, ulduzlar səmaya zinət verdikcə, yer kürəsində canlılar hərəkət etdikcə, yerdən bitkilər göyərdikcə, ağaclarda quşlar oxuduqca, aləmin yeganə yaradıcısının müqəddəs zatını yenidən həmd-səna və təqdis edib, onu pak və müqəddəs sayıram. Bu mübarək təfsiri cümə axşamı gecəsi Zilqədə ayının 22-də 1323-cü hicri ilində, saat 10.15-də bitirdim. Bu kitaba baxan pak qardaşlarımdan və ağıl sahibi uca şəxslərdən xahiş və ümidim odur ki,

əgər bir səhv, unutqanlıq və ya bir nöqsan görsələr, əfv edib, nalayiq sözlərlə məni yad etməsinlər. Çünki insan unutqandır. İnsanın səhv edib, nəyisə unutması təbiidir. Mən həqir düz dörd il bu kitabı yazmaq üçün əziyyət çəkib, öz əskik qabiliyyətim sayəsində tamamlaya bildim. İdrak və kamal sahiblərinin nəzərində məqbul olmasını ümid edib, bu mühüm işə yönəldim. Allaha həmd olsun, ümidsiz qalmayıb bu xeyir işi tamamlaya bildim. Hər bir işimi Allah-Təalaya həvalə edib, Ondan yardım istəyirəm.

## Şükür Sözü

Bizə bu yolu göstərən Allaha həmd olsun ki, əgər o hidayət etməsəydi biz doğru yolu tapmazdıq. Dinin və həqiqətin göstərdiyi, Allahın kəlamına və onun geniş rəhmətinə sığınıram. Əzəli və xaliq olan Mövladan xüşu ilə, boyun əyərək, zəlil bir bəndənin istədiyi kimi diləyirəm. Ona, günah dənizinə batanların yalvarışı kimi yalvarıram. Qəflət və xətalarımdan keçməsi üçün ən səmimi və sadiq dostun köməyini ümid edirəm . Tüğyan edən qələmin zəlalət və xətalarımı yazmaqdan yan keçməsini, nazil olmuş kəlamın məna və məqsədinə müxalif düşüncələrimin əfvini istəyirəm. Xeyir yollarının aydınlanlanmasında məni müvəffəq qılmasını, bəndələri cəhalət yanğınından xəbərdar etmə işində və onları ayələrin nuruna qovuşdurmaqda məni irşad etməsini diləyirəm.

Ya Rəb! Sənin möhkəm qulpundan yapışmışam. Həyatım boyu sənin böyüklüyünə bənd olmuşam. Ondan ayrıla bilmərəm. O sənin ap-açıq Furqanın və sarsılmaz kitabındır ki, açıq ayələrin və güclü dəlillərindir. Öldükdən sonra nə övladların, nə də mal-dövlətin fayda verməyəcəyi o ehtiyac günündə bunu bizə qənimət qıl!

Bu kitabın ərsəyə gəlməsində niyyətimi şirkdən və riyadan uzaq eylə! Vəchi-kərəminlə niyyətimi xalis eylə! Ey Cəlal və İkram sahibi! Sənə təvəkkül edir və sənə həvalə edirəm.

Mən günahlkar bəndə, Məhəmməd Kərim ibn Cəfər ibn Məhəmməd ibn Əli ibn Rəhmətullah ibn Məhəmməd ibn Həsən ibn İbrahim ibn Cəfər ibn Hüseyn ibn Yəhya ibn Mənsur ibn Abdullah ibn Məhəmməd ibn İsmail ibn Fəzl ibn Əli ibn Həmmad ibn Cəfər ibn Həşim ibn Hüseyn ibn Abbas ibn Qasim ibn Məhəmməd ibn Həsən ibn Fəyyaz ibn İbrahim ibn Əli ibn Abdullah ibn Əli ibn İsmail ibn Əli ibn Zeyd ibn İbrahim ibn İmam

Musa Kazım ibn İmam Cəfər Sadiq ibn İmam Məhəmməd Baqir ibn Zeynəlabidin ibn Şəhid İmam Hüseyn ibn İmam Əli ibn Əbi Talib. Allahın salamı onların üzərinə olsun!

Bir insanın öz nəslinin elm və irfanda dərəcə olaraq çox yüksək olması ona hər hans bir fayda verməz. Həmçinin bir insanın elm əhli, irfan sahibi ataları və keçmişilə də fəxr etməsi xoşagələn bir şey deyil.

Fəqət mən səmimi bir şəkildə ataların fəziləti və şanı haqqında Fərəzədkin bu şeirini dəlil göstərirəm:

*"Onlar mənim atalarımdır ki, ey Cərir;*
*Toplaya bildiklərin içərisindən mənə onlar kimisini gətir."*

Kiçik yaşlarımdan bəri elm-irfan təhsili ilə məşğul oldum və bir çox alimlə görüşdüm. Axırda bu qənaətə gəldim ki, bütün elmlərin açarı, bəşəriyyətin mədəniləşmə təməlləri və əxlaqi prinsipləri sadəcə Qurani-Kərimdədir ki, doğru yolu tapanlar onunla hidayət olunurlar. Bu səbəblə əziz vətən övladlarının yatdıqları qəflət yuxusundan oyanmaları üçün türk azərbaycan dilində təcvid, bəyan, sərf və nəhv qaydalarına müvafiq olaraq onun təfsirini, işarələrini, incəliklərini və ayələrini açıqlanmaq qərarına gəldim. Onun hər zamana olan lazımi hökmünə bağlı qalaraq var gücümlə aydınlaşdırmağa və təfsir etməyə çalışdım. Əziz Quranda qeyd edilən digər müxalif hökümlərin də izahını verdim. İmkan dairəsində ayələrin nazil olma səbəblərini hər cəhətcə qısaltdım.

Bu yazdıqlarıma hüsn-rəğbət göstərmələrini, əsərimizdə hər nə qədər vaqe olan xəta və səhv varsa, işin ərbabından düzəltmələrini təvəqqe edirəm. Belə olacağını da ümid edirəm.

*"Kəşfül-Həqayiq an Nukətil-Ayati vəd-Dəqayiq"* adlanan bu gözəl kitabın ələ-ərsəyə gəlməsini başa çatdırdım. Cümə axşamı saat on ikiyə on dəqiqə işləmişdi. Mübarək zülqadə ayının 22-si 1323-cü il idi. Allah yardım edəndir və təvəkkül də onadır.

## MÜNDƏRİCAT

